**2-Cİ NƏŞR**
**ƏLAVƏ VƏ DÜZƏLİŞLƏR**

## ƏHLİ SÜNNƏ VƏL CƏMAAT

# SƏLƏFİ SALİHİN ƏQİDƏSİ

## İ S L A M  V Ə  İ M A N

**Bu Kitab, Azərbaycan Respublikası Dini Qurumlarla İş Üzrə Dövlət Komitəsinin 06 Avqust 2008-ci İl Tarixli İcazəsi Əsasında Çap Edilmişdir №DK-96/H**

**TOPLAYAN VƏ TƏRTİB EDƏN**
**K.HÜSEYN**

**RƏHİMLİ VƏ MƏRHƏMƏTLİ OLAN ALLAHIN ADI İLƏ**

**«Ey Rəbbimiz! Bizi doğru yola yönəltdikdən sonra ürəklərimizə şəkk-şübhə** (azğınlıq, əyrilik) **salma! Bizə Öz tərəfindən bir mərhəmət bəxş et, çünki Sən, doğurdan da, bəxşiş verənsən!»** (Ali İmran 8).

**«Ey Rəbbimiz! Unutduqda və ya yanıldıqda bizi cəzalandırma! Ey Rəbbimiz! Bizdən əvvəlkiləri yüklədiyin kimi, bizi ağır yükləmə! Ey Rəbbimiz! Gücümüz çatmayan şeyi bizə yükləyib daşıtdırma! Bizi əfv edib bağışla, bizə rəhm et! Sən bizim ixtiyar sahibimizsən. Kafirlərə qələbə çalmaqda bizə kömək et!»** (əl-Bəqərə 286).

Allahım! Bütün əməllərimin saleh əməl olmasını və bunları heç kimsə üçün deyil, sadəcə sənin rizan üçün olmasını diləyirəm.

Allahım! Bu kitabı yazan üçün, tərcümə edən üçün, oxuyan üçün, dinləyən üçün, yayan üçün və bu kitabın üzərində əziyyəti olan hər bir kəs üçün xeyirli et! Amin!

بسم الله الرحمن الرحيم

إنَّ الحَمْدَ لله ، نَحْمَدُهُ ونَسْتَعِينُهُ ونَسْتَغْفِرُهُ، ونَعوذُ بالله مِنْ شُرورِ أنفُسنا ، ومِنْ سَيِّئات أعمالنا ، مَنْ يَهده اللهُ فلا مُضلَّ لهُ ، ومَن يُضلل فلاَ هَادي لَه ، وأشهدُ أنْ لاَ إله إلاَّ اللهُ وحدَهُ لاَ شَريكَ لَهُ ، وأَشْهدُ أنَّ مُحَمَّداً عبدُهُ ورَسُولُهُ.

﴿يا أيُّها الَّذينَ آمَنُوا اتَّقُوا اللهَ حَقَّ تُقاته وَلاَ تَمُوتُنَّ إلاَّ وأنْتُم مُسْلِمونَ﴾ سورة آل عمران : الآية ، ١٠٢.

﴿يا أيُّها النَّاسُ اتَّقُوا رَبَّكُمُ الَّذي خَلَقَكُم مِّن نَفْسٍ وَاحِدَةٍ وَخَلَقَ مِنْهَا زَوجَهَا وَبَثَّ مِنهُمَا رِجَالاً كَثيراً ونِسَاءً واتَّقُوا اللهَ الَّذي تَسَاءَلُونَ بِهِ وَالأَرْحَامَ إنَّ اللهَ كَانَ عَلَيكُم رَقِيباً﴾ سورة النساء : الآية ، ١.

﴿يَا أيُّها الَّذينَ آمَنُوا اتَّقُوا اللهَ وَقُولُوا قَولاً سَديداً ، يُصلِحْ لَكُم أعْمالَكُمْ ويَغْفِر لَكُمْ ذُنُوبَكُم ومَن يُطعِ اللهَ ورَسُولَهُ فَقَدْ فَازَ فَوزاً عَظِيماً﴾ سورة الأحزاب : الآية ، ٧١.

أما بعد : فإنَّ أصْدَقَ الحديث كلامُ الله ، وخَيرَ الهَدي هَديُ مُحَمَّد – صلَّىٰ اللهُ عليه وعلىٰ آله وسَلَّم – وشرَّ الأُمور مُحْدَثاتُها وكلَّ مُحْدَثَةٍ بِدعَةٌ ، وكلَّ بدعةٍ ضلالَةٌ ، وكلَّ ضلالةٍ في النَّار (*) .

---

(*) هذه الخطبة ؛ تسمَّىٰ : « خطبة الحاجة » وهي تُشرع بين يدي كلِّ حاجة ، والتي كان رسول الله ﷺ يعلِّمها أصحابه ؛ أن يقولوها بين يدي كلامهم ، في أمور دينهم سواء كان ؛ خطبة نكاح ، أو جمعة أو محاضرة ، أو غير ذلك ، وهي في : « سنن ابن ماجه » و « سنن الترمذي » و « سنن أبي داود » و « سنن النسائي » ، وورد ذكر طرف من هذه الخطبة في : « صحيح مسلم ».

# ÖN SÖZ

## *Xutbətul-Hacə*

Həmd ancaq Allahadır, Ona həmd edir, Ondan yardım və məğfirət diləyirik. Nəfslərimizin şərindən və pis əməllərimizdən Allaha sığınırıq. Allah kimi hidayətə yönəltmişsə, onu heç kəs azdıra bilməz, kimi də azdırmışsa, heç kəs onu hidayətə yönəldə bilməz. Mən şəhadət edirəm ki, Allahdan başqa ilah yoxdur. O, təkdir, şəriki də yoxdur və şəhadət edirəm ki, Muhəmməd Onun qulu və elçisidir.

***«Ey iman gətirənlər! Allahdan lazımınca qorxun. Yalnız müsəlman olduğunuz halda ölün».*** *(Ali-İmran 102).*

***«Ey insanlar! Sizi tək bir şəxsdən*** *(Adəmdən)* ***xəlq edən, ondan zövcəsini*** *(Həvvanı)* ***yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun***. *(Adı ilə)* ***Bir-birinizdən*** *(cürbəcür şeylər)* ***istədiyiniz Allahdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən qorxun. Şübhəsiz ki, Allah sizin üzərinizdə nəzarətçidir».*** *(ən-Nisa 1).*

***«Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin!*** *(Əgər belə etsəniz)* ***Allah əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs Allaha və Peyğəmbərinə itaət etsə, böyük bir səadətə*** *(Cənnətə)* ***nail olar».*** *(əl-Əhzab 70-71)* .

Şübhəsiz ki, sözlərin ən doğrusu Allahın kəlamı, yolların ən xeyirlisi Muhəmməd - *sallallahu aleyhi və səlləm* - in yoludur. Əməllərin ən pisi sonradan uydurulanlardır. Sonradan uydurulub dinə salınan hər bir əməl (iş) bir bidətdir, hər bir bidət isə zəlalətdir (sapıqlıqdır), hər bir zəlalət isə oddadır .

***«Ey Rəbbim! köksümü açıb genişlət, işimi yüngülləşdir, dilimdəki düyünü aç ki, sözümü yaxşı anlasınlar».*** *(Ta ha 25–28).*

---

[1] ***Xutbətul-Hacə*** - adı ilə məşhur olan bu duanı, cümə və s. xütbələrdə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - oxumuşdu. Səhabələrinə də bunu əmr etmiş və özü də onları öyətmişdir. Hədisin ilk hissəini bizə: – Əhməd 1/392-393,432, Əbu Davud 2188, Tirmizi 1105, Nəsəi 3/104-105, 6/69 və «Əməlul Yəum vəl Leyl» 488, İbn Məcə 1892, Darimi 2202, Tayalisi «əl-Musnəd» 1557, AbdurRazzaq «əl-Musənnəf» 10449, Bəzzar «əl-Musnəd» - Kəşful Əstar 1/314, Əbu Yəla «əl-Musnəd» 5233-5234,5257, Tahavi «Şərhul Müşkilil Asar» 1-3, Təbərani «Məcmuul Kəbir» 10/10079-10080, Həkim «əl-Mustədrək» 2744, Beyhəqi «Sünnənul Kubra» 3/214-215, Bəğavi «Şərhus Sunnə» 2268 İbn Məsud - *radıyallahu anhu* – yolu ilə, Müslim «Şərhu Nəvəvi» 6/156-158, Əhməd 1/302,350, Nəsəi 6/89-90, İbn Məcə 1893 və Tahavi «Şərhul Müşkilil Asar» 4 İbn Abbas - *radıyallahu anhu* – yolu ilə, Tahavi «Şərhul Müşkilil Asar» 5, Beyhəqi «Sünnənul Kubra» 3/215 Nubeyt b. Şərit - *radıyallahu anhu* – yolu ilə, Əbu Yəla «əl-Musnəd» 7221, Nəsəi «Sünnənul Kubra» bax: «Tuhfetul Əşraf» 6/472 № 9148 əbu Musa əl-Əşari - *radıyallahu anhu* – yolu ilə.

[2] ***Hədisin İkinci Hissəsini –*** Müslim «Şərhu Nəvəvi» 6/153-156, Əhməd 3/319,371, Nəsəi 3/188-189, Beyhəqi «Sünnənul Kubra» 3/214 Cabir b. Abdullah - *radıyallahu anhu* – yolu ilə. Bu ləfz Nəsainin ləfzidir. Hədisi Əhməd 3/371 və Müslim: «Sözlərin ən doğrusu» ləfzi yerinə: «Sözlərin ən xeyirlisi» ləfziylə rəvayət edilmişdir. İmam Əhmədin digər rəvayətlərində isə 3/319: «Sözlərin ən gözəli» şəkilindədir. Müslim: «Sonradan uydurulub dinə salınan hər bir əməl (iş) bidətdir» ləfzi yerinə: «Hər bir bidət bir zəlalətdir (sapıqlıqdır)» ləfziylə ravayət etmişdir. Hədisin sonunda olan: «Hər bir zəlalət isə oddadır» ləfzini zikr etməmişdir. Bu beş səhabədən başqa hədsi: Aişə - *radıyallahu anhə* –, Səhl b. Sad - *radıyallahu anhu* – mərfu olaraq. ***Mərfu Hədis -*** Bu o, hədisdir ki, hansısa bir əməlin, sözün və ya sifətin Peyğəmbər – *sallallahu aleyhi vəs səlləm* – ə çatması mərfu hədis adlanır. 1. ***əl-Mərfu əl-Qövli -*** Peyğəmbər – *sallallahu aleyhi vəs səlləm* – in dediyi söz. 2. ***əl-Mərfu əl-Feli -*** Peyğəmbər – *sallallahu aleyhi vəs səlləm* – in etdiyi əməl. 3. ***əl-Mərfu əl-Təqriru -*** Peyğəmbər – *sallallahu aleyhi vəs səlləm* – in görüb qadağan etmədiyi (hər hansısa bir əməl, və ya söz). 4. ***əl-Mərfu əl-Vəsfiyu -*** Peyğəmbər – *sallallahu aleyhi vəs səlləm* – in ən gözəl əxlaqlı olması. Tabiinlərdən isə İbn Şihab əz-Zuhri isə mursəl olaraq rəvayət etmişdir. ***Mursəl Hədis -*** Tabiin Peyğəmbər – *sallallahu aleyhi vəs səlləm* – dən danışır. Lakin onlar arasındakı ravini qeyd etmir. Səhabədən də mursəl rəvayət olur. Bu o, deməkdir ki, səhabə Peyğəmbər – *sallallahu aleyhi vəs səlləm* – in sözünü eşitmədən, əməlini görmədən danışır. Bu da onun o, vaxt uşaq olması və ya İslamı sonra qəbul etməsi ilə izah olunur. Bunlar da qəbul edilə bilər. Hədis səhihdir. Muhəddis Muhəmməd Nəsrəddin əl-Albani – *rahmətullahi aleyhi* – hədisin bütün rəvayətlərini bir yerə toplayaraq «Xutbətul Həcə» isimli bir kitab yazmışdır. İstəyənlər bu kitaba baxa bilərlər. Ayrıca bax: əl-Albani «Muxtəsər Səhih Müslim» 409, «Mişkətul Məsabih» 3149,5860.

Möhtərəm müsəlman bacı və qardaşlarım! İlk öncə hamınızı Allahın salamı ilə salamlayıram. Allahın kitabına və Rəsulullah - *sallallahu aleyhi və səlləm* – in yoluna uyaraq bu risaləni «***Bismilləh***» ilə başlayıram. Çünkü Allah Rəsulu - *sallallahu aleyhi və səlləm* - də öz məktublarını «***Bismilləh***» ilə başlamış və buyurmuşdu: «Hər mühüm bir işə «***Bismilləh***» ilə başlanılmazsa, o işin sonu kəsikdir» .

Allah - *subhənəhu və təalə* – nin bu ümmət üzərindəki nemətlərindən biri də heç şübhəsiz ki, bu ümmətin dinini kamil etməsi, bu ümmət üzərindəki nemətini tamamlaması və ona İslamı din olaraq seçmiş olmasıdır. Allah, Muhəmməd - *sallallahu aleyhi və səlləm* – i aləmlərə rəhmət, əməl edənlərə öndər, qullarına hüccət olaraq hidayət və haqq dini ilə göndərdi. O, - *sallallahu aleyhi və səlləm* - ona verilən əmanəti yerinə yetirdi, risalətini təbliğ etdi, ümmətinə öyüd verdi, dinin əsaslarından tutmuş hər bir şeyi incəliyinə kimi bizə xəbər verdi. Açıqlamadığı bir şey, ümmətini sövq etmədiyi bir xeyr və onları çəkindirmədiyi bir pislik buraxmadı. Səhabələr onun aydınlıq yolu üzərində yürüdükləri kimi, onların yollarına uyan kimsələr də bu yolda yürüməyə başladılar. Bu ümməti gecəsi gündüzü kimi aydın olan bir yolun üzərində buraxmamış canını təslim etmədi. Rəsulullah - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizə gecəsi gündüzü kimi tər-təmiz bir yol qoyuram. Bundan sonra kimsə yoldan azmaz. Azanlar isə həlak olurlar» . Belə ki, bu yoldan həlak olandan başqası azmaz. Bu rəhmət Peyğəmbəri, bu ümməti Cənnətə yaxınlaşdıracaq və Cəhənnəm atəşindən uzaqlaşdıracaq xeyir naminə hər nə varsa mütləq onu göstərmiş, nə qədər pislik varsa bu ümməti o, pislikdən çəkindirmişdir. Allah bizlərə anlaşılmazlığa düşdüyümüz məsələlərdə bu anlaşılmazlığı Allah və Rəsuluna buraxmağımızı tövsiyə edərək: ***«Əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və Qiyamət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərinə həvalə edin! Bu daha xeyirli və nəticə etibarı ilə daha yaxşıdır».*** *(ən-Nisa 59).*

Lakin bütün bunlara baxmayaraq günümüzdəki İslam ümməti, müsəlmanların ayrılığa düşməsi, firqə-firqə bölünməsi bu kitabın toplanmasına səbəb oldu. Bu camaat və firqələrin hər biri öz əqidəsinə və yollarına çağırmaqla insanları çaşqınlığa salmış, artıq insanların kimin ardınca gedəcək, kimin dediklərinə inanacaq çaşqınlığında qalmışlar. Gecə qaranlıqları kimi bidətlər ortaya çıxmağa başladı. Bu bidətlər, uydurmalar İslamı və müsəlmanları dağıtmağa və onların firqələrə və məzhəblərə bölünməsinə gətirib çıxartdı. Müsəlmanlar da cahilcəsinə bu bidətlərə doğru yürüməyə başladılar. İnanclarını bu çürümüş şeylər üzərində qurmağa başladılar. Əksinə Rəbbimiz isə bizə bir olmağımızı, heç bir firqə və məzhəblərə bölünməməyimizi, müsəlman olmağımızı əmr edir. ***«Hamınız bir yerdə Allahın ipindən möhkəm yapışın, bir-birinizdən ayrılmayın! Allahın sizə verdiyi neməti xatırlayın ki, siz bir-birinizə düşmən ikən o sizin qəlblərinizi birləşdirdi və onun neməti sayəsində bir-birinizə qardaş oldunuz. Siz oddan ibarət olan bir uçurumun kənarında ikən o sizi oradan xilas etdi. Allah öz ayələrini sizin üçün bu şəkildə aydınlaşdırır ki, bəlkə haqq yola yönəlmiş olasınız».*** *(Ali İmran 103).* ***«Açıq-aydın dəlillər gəldikdən sonra, bir-birindən ayrılan və ixtilaf törədən şəxslər kimi olmayın! Onlar böyük bir əzaba düçar olacaqlar».*** *(Ali İmran 105).* Onlar Rəblərinin kitabı və Nəbilərinin sünnətindən uzaqlaşdıqları üçün öz ağıllarına və nəfsi istəklərinə uydular. Sıratal Mustəqimdən ayrıldıqca yalanlamağa başladılar. Allah və Rəsulunun hökmünün önünə keçdilər.

---

[3] Əbu Davud.
[4] İmam Əhməd «Musnəd».

Beləcə də nəsildən-nəsilə zəlalətə düşdülər. İxtilaf edib firqələrə bölündülər. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Kim nübuvvət cizgisindən ayrılarsa şirkə və digər günahlar içərisinə düşər. İnsanların inanclarında şirk yox idi. Adəm – *əleyhissəlam* – və uşaqları Allahı tövhid etmək inancı üzərə idilər. İnsanlar tək bir ümmət idilər sonra ixtilafa düşdülər. ***«İnsanlar** (əvvəlcə) **ancaq tək bir ümmət idilər** (eyni bir dində idilər). **Sonra** (aralarında ixtilaf düşdüyü üçün) **ayrıldılar».** (Yunus 19)». **«İnsanlar tək bir ümmət idilər».** (əl-Bəqərə 213).* İbn Abbas – *radıyallahu anhu* – deyir ki: «Adəm ilə Nuh – *əleyhimussəlam* – arasında altı əsr (Başqa rəvayətdə: on əsr) vardır. Bu dövürdə yaşayan insanların hamısı da Allahın şəriəti üzərə idilər. Onların hamısı İslam dini üzərə idilər. Daha sonra ixtilafa düşdülər. Rəsulların şəriətlərinə uymağı tərk etdikləri üçün şirkə düşdülər. Allah da müjdələyən və qoxudan Rəsullar göndərdi. Göndərilən ilk Rəsul isə Nuh – *əleyhissəlam* – idi»[5].

Rəsuldan sonra, onun səhabələri bu dini ən gözəl bir biçimdə öyrəndilər. Rəblərinin onlara yükləmiş olduğu əmanəti ən xeyirli bir şəkildə əldə etdilər. ***«Biz əmanəti göylərə, yerə və dağlara təklif etdik. Onlar onu götürməkdən qorxub çəkindilər. Çox zalim və çox cahil insan isə onu götürdü».*** *(əl-Əhzab 72).* Bunu da özlərindən sonra gələnlərə əskiksiz olaraq daşıdılar. Tabiinlər də eyni minval üzərə bu əmanəti özlərindən sonra gələn sünnət əhli olanlara ötürdülər. Onlar da səhabələr yolu ilə onlara gələn bu əmanəti pozmadan, ağıl və istəklərinə uymadan, bidətlərə yol vermədən haqqıyla qoruyub, Nəbiləri - *sallallahu aleyhi və səlləm* – in sünnətinə və əsərlərinə sahib çıxaraq ona sımsıxı sarıldılar və özlərindən sonra gələn cəmaata öyrətdilər.

Allaha şükürlər olsun! Bu ümmətdə xeyir olub və bu xeyir əsla tükənməyəcəkdir. Qiyamətin qopacağı vaxta qədər bu ümmətin hidayət və haqqa sarılan, azı dişləri ilə ondan yapışan bir qism cəmaat olacaqdır. Onlar Allahın izni ilə bu dinə sahib çıxaraq onu qoruyacaqlarına əhd etmişlər. ***«Möminlər içərisində elələri də vardır ki, Allahla etdikləri əhdə sadiq olarlar».*** *(əl-Əhzab 23).* Səvban – *radıyallahu anhu* – dən gələn rəvayətdə Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurur: «Ümmətimdən bir qrup insanlar olacaq ki, Qiyamətin qopacağı vaxta qədər haqq üzrə gedəcəklər. Heç nə və heç kim onlara zərər vura bilməyəcək. Allahın əmri gəlincəyə qədər»[6]. İmran b. Hüseyn - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ümmətimdən Qiyamət saatı gəlincəyə qədər haqq üzərə savaşacaq olan kimsələr olacaqdır. Onlarla döyüşənlərə qarşı müzəffərdilər (yenilməz). Onların sonuncuları Məsih Dəccəllə qarşı döyüşən (cəmaatdır)»[7]. Bu cəmaat Firqətun Nəciyə – qurtuluşa çatan firqə, Əhli Sünnə vəl Cəmaat, Sələfi-Salihin, Əhli Hədis və s. deyə adlandırılmışdır. Onlar isə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in və əshabələrin izləmiş olduğu yolu davam etdirən kimsələrdir. Əbu Nəcih əl-İrbad b. Səriyə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – bizimlə elə bir tərzdə danışdı ki, qəlblərimiz titrədi, gözlərimiz yaşla doldu. Biz dedik: «Ey Allahın Rəsulu, bu vidalaşan bir kişinin öyüdünə oxşayır, bizə vəsiyyət et». Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mən sizə Uca və Böyük olan Allahdan haqq təqvası ilə qorxmağınızı, başınıza Həbəşı bir kölə əmir olaraq təyin edilərsə, onu dinləyib itaət etməyinizi tövsiyə edirəm. Şübhəsiz ki, aranızdan (uzun bir ömür)

---

[5] İbn Kəsir 1/250, Məcmuul Fətava 20/106.
[6] Buxari, Müslim.
[7] Əbu Davud "Cihad" 4, 2484, İmam Əhməd.

yaşayacaq olanlar bir çox ayrılıqlar görəcəklər. Mən sizə mənim sünnətimə və hidayətdə olan Rəşidi xəlifələrin sünnəsinə sarılmağınızı tövsiyə edirəm. Ona möhkəm sarılın, arxa dişlərınızlə ondan yapışın. Sonradan uydurulan işlərdən uzaq durun. Çünkü sonradan uydurulan hər bir şey bir bidət, hər bir bidət isə zəlalətdir» . Əbu Amr Abdullah b. Luhey deyir ki, Muaviyə b. Əbu Sufyan ilə birlikdə həcc etdik. Məkkədə zöhr namazından sonra ayağa qalxıb dedi: «Allah Rəsulu – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mənim ümmətim yetmiş üç firqəyə bölünəcəkdir. Biri xaric hamısı Cəhənnəmdədir. O, da cəmaatdır. Mənim ümmətimdən elə bir topluluq çıxacaq ki, ağıl və istəkləri onları itlərin sahiblərini təqib etdikləri kimi təqib edib onlarla bərabər olacaqdır. Ey ərəb topluluğu! Vallahi, əgər siz Peyğəmbərnizdən gələnə sahib çıxmasanız, ona sizdən daha yaxşı sahib çıxacaq kimsələr olacaqdır» .

Allah bu ümməti firqələr arasında ***Vasat*** – həmçinin də bu ümmət əvvəlki ümmətlər arasında da ***Vasat*** – olandır. ***«Beləliklə də, sizi Vasat bir ümmət etdik ki, insanların əməllərinə şahid olasınız».*** *(əl-Bəqərə 143).* ***Vasat*** – ədalətli, xeyirli kimsələr mənasındadır. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü Nuh çağırılacaq. O, buyur, ya Rəbbim, əmrinə hazıram» deyəcək. Allah ona: «Təbliğ etdinmi?» deyə soruşacaq. O, da: «Bəli, ya Rəbbim!» deyəcək. Allah bu dəfə onun ümmətinə buyuracaq: «Sizə təbliğ etdimi?» Onlar: «Bizə heç kim təbliğ etmədi» deyəcəklər. Bu dəfə Allah ona: «Sənin lehinə kim şahidlik edə bilər?» deyə soruşacaq. O, da: «Muhəmməd və onun ümməti» deyəcək. Onun təbliğ etdiyinə şahidlik edəcəklər. Rəsulullah da ona qarşı şahid olacaq. Allah buyuracaq: «Beləcə sizi vasat bir ümmət etdik ki, insanlara qarşı şahid olasınız» .

O, halda bu ümmət zərər verən, sapmış ümmətlər ilə həlaka aparan qüsurlu yollara meyl etmiş firqələr arasında vasat bir ümmətdir. Onlar Sıratal-Mustəqimdən sapmış ümmətin bidətçi firqələri arasında orta yolu tutmuş vasat olanlardır. Auf b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yəhudilər yetmiş bir firqəyə bölünəcəklər, onlardan yalnız biri Cənnətə qalanları isə Cəhənnəmə düşəcəkdir. Xristianlar yetmiş iki firqəyə bölünəcəklər, onlardan yalnız biri Cənnətə qalanları isə Cəhənnəmə düşəcəkdir. Qəlbim əlində olan Allaha and olsun ki, mənim ümmətim yetmiş üç firqəyə bölünəcəkdir, onlardan yalnız biri - Cənnətə, qalanları isə Cəhənnəmə düşəcəkdir» . İbn Ömər - *radıyallahu anhu* – nun rəvayətində isə səhabələr Cənnətə düşən firqə haqqında soruşdular. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Onlar mənim və səhabələrimin yolu ilə gedənlərdir» . Başqa rəvayətdə: Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «O, da cəmaatdır» . Abdullah b. Amr b. əl-As - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ümmətimin başına İsrail oğullarının başına gələnlərin bənzəri gələcəkdir. Hətta onlardan biri anası ilə zina etmiş olarsa ümmətimin içindən də bunu edən birisi tapılar. İsrail oğulları yetmiş iki firqəyə ayrıldılar. Mənim ümmətim isə yetmiş üç firqəyə ayrılacaqdır. Biri xaric olmaqla qalanları cəhnnəmdədir». Səhabələr: «Ey Allahın Rəsulu! Cənnətə düşən firqə

---

[8] Əbu Davud 4607, Tirmizi 2676.
[9] Həkim, əl-Albani səhih.
[10] Buxari 4487, İbn Həcər «Fəthul Bəri» 8/172.
[11] İbn Məcə 2/479.
[12] Əbu Davud 2/503, Tirmizi 3/367, əl-Albani «Səhih Hədislər Silsiləsi» 1348.
[13] İmam Əhməd «Musnəd» 4/102, əl-Albani «Ziləlul Cənnə».

hansıdır» deyə soruşdular. Peyğəmbər: «Onlar mənim və səhabələrimin yolu ilə gedənlərdir» .

Bütün bu hədislər bizlərə Cəhənnəm atəşindən qurtulmuş toplumun orta yolu mənimsəmiş Əhli Sünnə Vəl Cəmaat olduğunu açıqca göstərməkdədir. Çünkü onlar bütün ixtilaflarda orta yolu tutmuş, Kitab və Sünnətin bildirdiyi iman əsaslarından başqa hər hansı bir inanca yönəlməmiş, insan üçün lazımlı hər şeyin bu iki qaynaqda bəyan edildiyinə inanmışlar. Sünnəti bəyan etmək, əsaslarını gücləndirmək və bidətləri yıxmaq üçün bir çox əsərlər də yazmışlar.

Buna görə də hörmətli müsəlman bacı və qardaşlarım hər biriniz bu müxaliflərə qarşı mübarizə aparmalısınız. Çünki bu İslam və müsəlmanların düşmənlərinin fikirləri birdir. Allahın nurunu söndürmək, yəni İslamı məhv etməkdir. Lakin bu əsla belə deyildir. Allah buyurur: ***«Onlar Allahın nurunu** (İslam dinini) **öz ağızları** (öz iftiraları və şər sözləri) **ilə söndürmək istəyirlər. Allah isə kafirlərin xoşuna gəlməsə də öz nurunu** (dinini) **tamamlayacaqdır».*** *(əs-Səff 8).* Allahu Əkbər! Həqiqətən də onların xoşlarına gəlsə də, gəlməsə də belə Allah öz dinini qoruyur və tamamlayır. Hər dövrdə, hər zamanda, hər vaxtda Allahın dinini bəxş etdiyi iman, elm və hikmət ilə din düşmənlərinə qarşı vuruşan, onların hiylələrinə, bidətlərinə qarşı çıxan, bidətlərini yox edən və onları Quran və Sünnə ilə məhv, Allahın dinini qoruyan və Allaha yardım edən sünnət əhlindən olan cəmaat olub və olacaqdır. İnşəallah! ***«Ey iman gətirənlər! Əgər siz Allaha yardım göstərsəniz, o da sizə yardım göstərər və sizi sabitqədəm edər».*** *(Muhəmməd 7).* Allaha yardım göstərmək isə onun dinini qorumaq ilə olur. İbn Məsud – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allahın məndən əvvəlki ümmətlərə göndərdiyi hər Nəbinin öz ümmətindən sünnətini alan və əmrlərinə uyan bir çox həvvariləri və səhabələri vardır. Sonra onların ardından etməyəcəkləri şeyləri söyləyən və əmr olunmadıqları işləri edən bir çox nəsillər zühur edər. Kim onlara qarşı əli ilə mübarizə aparmarsa o, bir mömindir. Onlara qarşı kim diliylə mübarizə aparmarsa o, da bir mömindir. Onlara qarşı kim qəlbi ilə mübarizə aparmarsa o, da mömindir. Amma bundan aşağı (imandan) bir xardal dənəsi qədər də iman yoxdur» . Başqa bir hədisdə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bu elmi sonradan gələn hər bir nəsildən o, nəslin ədalət sahibi olan adamları daşıyır. Onlar bu elmdən azdıranların təhriflərini, batil işlərlə məşğul olanların işlərini və cahillərin yalnış izahlarını aradan götürürlər» . Əbu Hureyrə - *radıyallahu anhu*– rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Heç şübhəsiz ki, Allah bu ümmət üçün hər yüz ilin başlanğıcında dinini qoruyan kimsələr göndərəcəkdir» .

Bu batil firqələrin yoluna uymamaq, onların ardınca getməmək üçün, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in yoluna uymaq, hidayət yolunda olan cəmaatdan olmaq üçün hər bir müsəlman, hər bir şəxs öz əqidəsini gözəl bir şəkildə öyrənməli, öyrəndikdən sonra isə ona əməl edib başqalarına öyrətməlidir. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – bu məsələ ilə bağlı demişdir: «Buna görə də Əhli Sünnə alimləri - Sünnətə sarılmaq qurtuluşdur demişlər». Allah rəhmət etsin İmam Məlik – *rahmətullahi aleyhi* – deyir: «Sünnət Nuhun gəmisi kimidir, minən qurtulur, arxada

---

[14] əl-Albani «Səhih Tirmizi» 2/333.
[15] Müslim.
[16] əl-Xatib «Şərəfu Əshəbil Hədis» 28-29, İbn Adiy «əl-Kamil» 1/152,153, 3/902, Saleh əl-Suheymi «Ulul Əbsarın Qeyidləri» s. 64.
[17] Əbu Davud «Məlahim» 4391.

qalan isə həlak olur. Haqq budur. Çünki Nuhun gəmisinə Peyğəmbəri təsdiq edən və ona tabe olanlar minmişlər. Ona minməyənlər isə Peyğəmbəri yalan saymışlar. Sünnətə tabe olmaq Allah qatından gələn risalətə tabe olmaq deməkdir. Dolayısı ilə risalətə tabe olan, Nuhla bərabər gəmiya minən kimsə durumundadır. Risalətə tabe olmaqdan ayrılan kimsə də Nuha tabe olmaqdan və onunla bərabər gəmiyə minməkdən qaçan kimsə durumundadır» . Bu batiniyyə firqələrin yoluna uymamaq, onların ardınca getməmək üçün, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in yoluna uymaq, hidayət yolunda olan cəmaatdan olmaq üçün hər bir müsəlman, hər bir şəxs öz əqidəsini gözəl bir şəkildə öyrənməli, öyrəndikdən sonra isə ona əməl etməlidir.

Bu baxımdan da mən bu kitabı topladım. Bu kitabı yazmaq, toplamaq üçün Quran və Sünnəyə uyaraq və İslamın elm adamlarının əsərlərindən geniş istifadə edərək Allahın izni ilə əlimizdəki bu kitabın yazılmasına nail oldum. Bu kitabda İslamın və İmanın əsaslarından danışaraq, onlara geniş bir şəkildə yer vermişəm və hər oxucu ondan faydalansın deyə aydın, dəlillərlə göstərməyə çalışdım. İlk növbədə Allahdan bu çalışmamın dolğun, düzgün şəkildə yazıb başa çatdırılmasını diləyirəm. Allahdan əməlimi onun üçün ixlaslı olmasını, məndən qəbul edib onunla müsəlmanları faydalandırmasını diləyirəm. Əgər hardasa xəta etmişəmsə bu nəfsimdən və şeytandandır. Burada düzəldilməsi mühüm olan yerləri tapdıqdan sonra mənə öyüt-nəsihət verməkdən çəkinməyə-cəyinizi ümid edirəm.

Güvəndiyim Allahdır, işlərimi ona həvalə edirəm və ona arxalanıram. Həmd və nemət yalnız onadır. Müvəffəqiyyət bəxş edən və xətalardan qoruyan da odur. ***«Məni yaradan və məni doğru yola yönəldən Odur! Məni yedirdən də, içirdən də Odur! Xəstələndiyim zaman mənə yalnız O şəfa verir. Məni öldürəcək, sonra dirildəcək də Odur və Qiyamət günü xətamı bağışlayacağına ümid etdiyim də Odur! Ey Rəbbim! Mənə hikmət bəxş et və məni salehlərə qovuşdur! Sonra gələnlər arasında mənə yaxşı ad qismət et! Məni Nəim Cənnətlərinin varislərindən et».*** *(əş-Şuəra 78-85).*

Allahın salat və salamı onun Peyğəmbəri Muhəmmədə - *sallallahu aleyhi və səlləm* -, onun ailə üzvlərinə, səhabələrinə və Qiyamətə qədər onun yolu ilə gedən saleh möminlərin üzərinə olsun.

## ƏHLİ SÜNNƏ VƏL CƏMAAT SƏLƏFİ SALİH

***Əqidə*** – Əqd sözündəndir. Bağlamaq, yaxşı bağlamaq, düyün vurmaq deməkdir. İnsanın qəlbində kəsin olaraq qəbul etdiyi şey istər haqq, istər batil olsun əqidədir.

***İstilahi Mənası –*** Əqidə insanın heç bir şəkk-şübhə və tərəddüd olmayaraq kəsin olaraq inanması deməkdir. Əgər bir inanc yəqinlik dərəcəsinə çatmazsa ona əqidə deyilməz .

İslam əqidəsi deyildiyi zaman Əhli Sünnə vəl Cəmaatın əqidəsi başa düşülür. Çünki Allahın qulları üçün bəyənib seçdiyi İslam budur. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* -, Səhabə, Tabiin və onlara gözəl bir şəkildə tabe olanların yoludur.

***Sələf*** – keçən, keçib gedən, keçmiş deməkdir. Keçmiş cəmaatdır. ***«…Və onları sonradan gələnlər üçün sələf*** *(keçmiş)* ***və ibrət dərsi etdik».*** *(əz-Zuxruf 56).* əl-Kaşani sələfi belə tanıdır: «Sələf bu ümmətin Allah Rəsuluna uyan, elm və fəzilətdə dəyər

[18] Məcmuul Fətava 4/137.
[19] «Lisanul Ərab», «Kamusul Muhit», «Mucəmul Vəsit» Ayn, Kəf, Dəl maddəsi.

sahibi olan ilk zümrəsidir. Allah onları Rəsulunun dostları etdi. Onlarla dinini yer üzündə yaydı. Onlar mallarıyla, canlarıyla Allah yolunda cihad etdilər. Yaxşılığa və xeyirə dəvətdə hər zaman bu ümmətə yol göstərdilər. Sonra gələnlər də onlara uyub, onları sevdilər. Allah onları kitabında tərif etmişdir. Belə isə onların yoluna uyub onlar üçün dua etməli və istiğfar etməlidir» . İmam Qazzali – *rahmətullahi aleyhi* – deyir ki: «***Sələflər* –** Səhabə və Tabiinlərdir» . əl-Bəycuri – *rahmətullahi aleyhi* – deyir ki: «***Sələf*** – Nəbilər, Səhabə, Tabiin, onlara uyanlar və dörd imamdır» .

***Mən Sələfiyyəm?*** – Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – ona sual verən kimsəyə bu kəliməni belə açıqlayır: «Əgər sənə: «Məzhəbin nədir?» deyə soruşsalar cavabşn necə olar? Sual verən: «Mən bir müsəlmanam» deyərəm. Şeyx: «Bu kifayyət deyil». Sual verən: «Allah bizləri müsəlman olaraq adlandırıb – deyib bu ayəni oxudu: ***«****(Ey Muhəmməd ümməti)* ***Allah bundan*** *(Quran nazil olmamışdan)* ***əvvəl də, bunda da*** *(Quranda)* ***da sizə müsəlman adını verdi».*** *(əl-Həcc 78).* Şeyx: «Bu cavab İslamın ilk dövründə, müxtəlif firqələrin ortaya çıxmadığı və yayılmadığı bir zamanda deyilsəydi doğru olardı. Günümüzdə isə (müxtəlif məzhəb və təriqətlərdə) olan birisinə bu sualı versək cavabı sənin verdiyin cavabdan fərqli olmayacaqdır. Əşari, Mətrudi, Xəvaric, Ələvilər və s. deyəcəklər ki: «Mən müsəlmanam!». Sual verən: «Mən Quarn və Sünnəyə uyğun əməl edən bir müsəlmanam». Şeyx: «Bu cavab da kifayət deyirldir». Sual verən: «Niyə görə?». Şeyx: «Bu adı çəkilən firqələrdən hər hansı birinin belə dediyi mənə göstərə bilərsən: Mən Quran və Sünnəyə tabe olmayan bir müsəlmanam – (sözsüz ki, bu mümkün deyil). Onlar da: «Mən Quran və Sünnəyə tabe olan müsəlmanam» deyəcəkdir. Sonra Şeyx Quran və Sünnəyə tabe olmağın ancaq Sələfi Salihin anlayışı ilə olması lazım olduğunu göstərir. Daha doğrusu: «Mən Sələfiyyəm» deməkdir.

Yaşca və fəzilətcə sizdən böyük olan ata və babalarınız sizin sələfinizdir . Buna görə də ilk müsəlmanlara Sələfi Salihin adı verilmişdir. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - Səhabəsi və gözəl bir şəkildə onlara tabe olanlar bu ümmətin sələfidirlər. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in səhabələrinin və onlara gözəl bir şəkildə uyanların dəvət etdiyi şeylərə dəvət edən hər bir kəs də sələfi yolu üzərindədir. İmanlarındakı sədaqətləri və ibadətlərindəki ixlasları ilə onlar uyulmağa ən layiq insanlardır ki, Allah İslam məsajını bütün yer üzünə təbliği üçün onları seçmişdir. Sələfi Salihə uyan və onların metodunu (Quran və Sünnəni) təqib edən digər müsəlmanlar da sələfə nisbət olaraq Sələfi deyilir. Quran və Sünnə ilə yaşayan hər bir kəs sələfə tabe olan kimsədir. İstər zaman və məkan etibarı ilə onun ilə onlar arasında uzun bir müddət olsun. Onlara müxalif olan isə onlar arasında yaşamış olsa da belə onlardan deyildir. ***«Hər kəs özünə doğru yol aşkar olandan sonra Peyğəmbərdən üz döndərib möminlərdən qeyrisinin yoluna uyarsa, onu istədiyi*** *(özünün yönəldiyi)* ***yola yönəldər və Cəhənnəmə varid edərik. Ora necə də pis yerdir».*** *(ən-Nisa 115).*

Sələfi Salihin əvvəli Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – dir. ***«Muhəmməd Allahın Peyğəmbəri. Onunla birlikdə olanlar*** *(möminlər)* ***kafirlərə qarşı sərt, bir-birinə*** *(öz aralarında)* ***isə mərhəmətlidirlər».*** *(əl-Fəth 29).*

---

[20] əl-Miğrari «Tahrirul Məkan» 1/18.
[21] İkanuul Avam və İlmil Kəlam s. 62.
[22] Şərhul Cəvhərə s. 111.
[23] «Lisanul Ərab», «Kamusul Muhit» Sin, Ləm, Fə maddəsinə bax.

Allah, ona itaət ilə Rəsuluna itaəti bir yerdə qeyd edərək buyurur: ***«Allaha və Peyğəmbərə itaət edənlər*** *(axirətdə)* ***Allahın nemətlər verdiyi Nəbilər*** *(Peyğəmbərlər)* ***siddiqlər*** *(təmamilə doğru danışanlar, etiqadı dürüst, Peyğəmbəri hamıdan əvvəl təsdiq edən şəxslər)****, şəhidlər və salehlərlə*** *(yaxşı əməl sahibləriylə)* ***bir yerdə olacaqlar. Onlar isə necə də gözəl yoldaşlardır».*** *(ən-Nisa 69).*

Allah, Rəsuluna itaəti ona itaət olaraq adlandırmış və buyurmuşdu: ***«Peyğəmbərə itaət edən şəxs, şübhəsiz ki, Allaha itaət etmiş olur. Kim üz döndərsə, biz ki, səni onların üzərində gözətçi olmağa göndər-məmişik».****(ən-Nisa 80).*

Allah, Rəsuluna itaət etməməyi əməllərin boşa çıxartmaq olduğunu qeyd edərək buyurur: ***«Ey iman gətirənlər! Allaha itaət edin, Rəsuluna itaət edin və əməllərinizi boşa çıxartmayın».*** *(Muhəmməd 33).*

Allah bizlərə Rəsulunun əmrlərinə mıxalif olmamağımızı qadağan edərək buyurur: ***«Hər kəs Allaha və Peyğəmbərinə itaət etməyib onun sərhədlərini aşarsa, Allah da onu həmişəlik Cəhənnəmə daxil edər. Onu rüsvayedici əzab gözləyir».*** *(ən-Nisa 14).*

Allah bizlərə Peyğəmbərinin bizə əmr etdiklərini yerinə yetirməyimizi və qadağan etdiklərindən çəkinməyimizi əmr edərək buyurur: ***«Peyğəmbər sizə nə verirsə onu götürün, nəyi qadağan edirsə, ondan əl çəkin. Allahdan qorxun. Həqiqətən, Allahın cəzası çox şiddətlidir».*** *(əl-Həşr 7).*

Allah bizlərə Peyğəmbər - *sallallahu aleyhi və səlləm –* i həyatımızın bütün xüsuslarında hakim təyin etməyimizi əmr edərək buyurur: ***«Amma xeyr! Sənin Allahına and olsun ki, onlar öz aralarında baş verən ixtilaflarda səni hakim təyin etməyincə və verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan sənə tam bir itaətlə boyun əyməyincə iman gətirmiş olmazlar».*** *(ən-Nisa 65).*

Allah ona olan sevgini Rəsuluna itaət ilə bağlayaraq buyurur: ***De ki: «Əgər Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın. Allah bağışlayan və mərhəmətlidir».*** *(Ali İmran 31).*

Buna görə də Peyğəmbər, Səhabə və Tabiinlərə uymaq daha doğru, nəticə etibarı ilə daha xeyirlidir. Peyğəmbər - *sallallahu aleyhi və səlləm –* buyurur: «İnsanların ən xeyirliləri mənim əsrimdəkilərdir. Sonra onların ardınca gələnlər, sonra yenə onların ardınca gələnlər» .

Peyğəmbər - *sallallahu aleyhi və səlləm –* dən sonra sələfin ən xeyirlisi sidq və ixlas üzərə dini Rəsulullah - *sallallahu aleyhi və səlləm –* dən öyrənən Səhabəi Kiramdır. ***«Möminlər arasında elələri də vardır ki, Allahla etdikləri əhdə sadiq olarlar. Onlardan kimisi*** *(bu yolda)* ***şəhid olmuş, kimisi də*** *(şəhid olmasını)* ***gözləyir. Onlar*** *(verdikləri sözü)* ***əsla dəyişməzlər».*** *(əl-Əhzab 23).* ***«****(İslamı)* ***ilk əvvəl qəbul edib*** *(başqalarını bu işdə)* ***qabaqlayan mühacirlərə və ənsara, həmçinin yaxşı işlər görməkdə onların ardınca gedən kimsələrə gəldikdə, Allah onlardan, onlar da Allahdan razıdırlar. Allah onlar üçün əbədi qalacaqlar, altından çaylar axan Cənnətlər hazırlamışdır. Bu ən böyük qurtuluş və uğurdur».*** *(ət-Tövbə 100).*

Sələf yolu müsəlmanı bir başa olaraq Allah və Rəsulu - *sallallahu aleyhi və səlləm –* ə və onların sevgisinə bağlayır. Çünki Sələfi etiqadının qaynağı havadan və insan ağlının qüsurlarından uzaq olaraq, Allah və Rəsulu - *sallallahu aleyhi və səlləm –* in buyurduqlarına dayanır. Bu əqidə olduqca gözəl, başa düşülən və aydın bir əqidədir. Sələf etiqadını mənimsəyən kimsə şəkk-şübhələrdən və şeytanın vəsvəsələrindən uzaq-

---

[24] Buxari, Müslim.

dır. Çünki bu əqidəyə inanan hər bir insan bu ümmətin Peyğəmbərinin, Səhabəi-Kiramın göstərdiyi yol üzərində yürüyür.

***Sünnə*** – lüğətdə – ***Sünnə, Yəsinnu***, ***Yəsunnu*** deməkdir. Sünnəyə əməl etmək, sünnəyə riayət etmək mənasında işlədilir. Sünnə olunmuş əmələ «***Məsnun***» deyilir. ***Sənnəl Əmra*** – bir işi açıqladı deməkdir. Başqa bir mənası: Sünnə izlənilən yol, həyat tərzi (sira) və s. deməkdir . Allah Qurani Kərimdə buyurur: ***«Allahın evlərinizdə oxunan ayələrini və hikməti*** *(Sünnəni)* ***xatırlayın…»*** *(əl-Əhzab 34).* ***«…Sənin ayələrini onlara oxusun Kitabı və hikməti onlara öyrətsin…»*** *(əl-Bəqərə 129).* ***«…Çünki Allah sənə Quranı və hikməti nazil edərək bilmədiklərini öyrətdi»*** *(ən-Nisa 113).* ***«…Onlara Kitabı və hikməti öyrədər»*** *(əl-Cumuə 2).* Muaz b. Cəbəl - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – onu Yəmənə göndərərkən belə buyurmuşdu: «Sənə bir məsələ haqqında hökm verməyini istəyənlərə necə hökm verəcəksən?» Muaz: «Allahın Kitabı ilə hökm verəcəyəm» dedi. Peyğəmbər: «Əgər Allahın Kitabı olmasa?» Muaz: «Onda Allahın Elçisinin sünnəsi ilə (hökm verəcəyəm)» .

***İstilahi Mənası*** - Rəsulullah - *sallallahu aleyhi və səlləm* – in və səhabələrin elm, etiqad, söz, davranış və təqrir (edilən, lakin qadağan olunmayan) xüsuslarda izlədikləri yol deməkdir. Sünnənin ziddi bidətdir.

***Cəmaat*** – bir şeyin parçalarını bir-birinə yaxınlaşdırdım, cəm etdim demək olan ***Cəm*** sözündən alınmışdır. Mən onu cəm etdim və s. Cəmaat ictimadan törənmişdir. Ayrılıb dağılmağın və ayrılmağın ziddidir. Cəmaat çoxlu sayda insan və eyni məqsəd ətrafında birləşən insanlar topluluğu deməkdir . Cəmaata bu adın verilməsinin səbəbi cəmaatın ictima kəlməsi ilə eyni mənaya malik olmasıdır. Ziddi təfriqədir. Cəmaat kəlməsi hər nə qədər bir yerə yığılan topluluğun adı olsa da, qeyd etdiyimiz mənaya gəlir . Qatadə – *rahmətullahi aleyhi* – deyir ki: «Onlar Allahın rəhmətinin əhlidirlər. Ölkələri, bədənləri ayrı olsa da, cəmaat əhlidirlər. Allaha üsyan edənlər isə ölkələri və bədənləri bir yerdə olsa da ixtilaf və ayrılıq əhlidirlər» .

***İstilahi Mənası*** – müsəlmanların cəmaatı olub, bunlar da səhabələr, tabiin və Qiyamət gününə qədər onlara gözəl bir şəkildə uyan, Kitab və Sünnə ətrafında toplanmış, Rəsulullah - *sallallahu aleyhi və səlləm* – in həm zahirən və həm də batinən getdiyi bu yolu izləyən bu ümmətin sələfi deməkdir. Allah mömin qullarına cəmaat olmaqlarını, bir-biri ilə qaynayıb yardımlaşmalarını əmr etmiş, onlara təfriqəni, ayrılığı və bir-birlərini didmələrini qadağan etmişdi. ***«Hamınız bir yerdə Allahın ipindən möhkəm yapışın, bir-birinizdən ayrılmayın! Allahın sizə verdiyi neməti xatırlayın ki, siz bir-birinizə düşmən ikən o sizin qəlblərinizi birləşdirdi və onun neməti sayəsində bir-birinizə qardaş oldunuz. Siz oddan ibarət olan bir uçurumun kənarında ikən o sizi oradan xilas etdi. Allah öz ayələrini sizin üçün bu şəkildə aydınlaşdırır ki, bəlkə haqq yola yönəlmiş olasınız».*** *(Ali İmran 103).* ***«Açıq-aydın dəlillər gəldikdən sonra, bir-birindən ayrılan və ixtilaf törədən şəxslər kimi olmayın! Onlar böyük bir əzaba düçar olacaqlar».*** *(Ali İmran 105).* Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Cəmaata möhkəm bağlanın. Ayrılıqdan çəkinin, çünki şeytan tək qalanla birlikdədir. O, iki nəfərdən uzaqdır. Kim

---

25 «Lisanul Ərab» 13/225.
26 Darimi «Sünən» səh 57.
27 «Mucəmul Vəsit» 1/136.
28 «Məcmuə Fətava» 3/157.
29 Muxtəsər İbn Kəsir 2/236.

Cənnətin geniş yerini istiyirsə həmən cəmaata möhkəm sarılsın» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şübhəsiz ki, Allah mənim ümmətimi sapıqlıq üzərində bir yerə cəm etməz. Allahın əli cəmaat üzərindədir. Kim ayrılarsa atəşə doğru ayrılmış olar» . Çünki burada Sünnət bidətin qarşısında, Cəmaat da təfriqənin, ayrılığın qarşısındadır.

İbn Abbas - *radıyallahu anhu* – Allahın: ***«Bəzi üzlər ağ, bəzi üzlərin isə qara olacağı gündə….».*** *(Ali İmran 106)* ayəsini təfsir edərkən demişdi: «Əhli Sünnə vəl Cəmaatın üzləri ağaracaq, bidət və təfriqə əhlinin üzləri isə qaralacaq» . Numan b. Bəşir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «…Və cəmaat rəhmətdir, ayrılıq isə əzabdır» .

İslam ümmətini ilk nəslinin saf və səlim əqidəsi budur. Bu əqidənin qaynağı Kitab, Sünnət, Sələf imamlarının sözləridir. Ümmətin ilk nəslinin qəlbləri bu əqidə ilə dirilmişdir. Bu Sələfi Salih, Firqətul Nəciyə, Əhli Hədis, Əhli Sünnə vəl Cəmaat, Dörd İmam və alimlərin bu günə qədər və Qiyamətə qədər onların yolunu təqib edənlərin əqidəsidir. Sonradan gəlib onların sözlərini dəyişdirənlərin yolları sizi aldatmasın. İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in ətrafında oturmuşduq. O, torpaq üzərində bir düz xətt çəkərək buyurdu: «Bu düz yol Allahın haqq yoludur». Sonra bu düz yolun sağ və sol tərəflərindən yollar (xətlər) çəkdi: «Bu isə digər yollardır. Bu yolların hər birinin başında o, yolu izləməyə dəvət edən bir şeytən vardır. Bu yolu gələnlər üçün gözəlləşdirir» deyə buyurdu və bu ayəni oxudu: ***«Bu şübhəsiz ki, mənim doğru yolumdur. Onu tutub gedin. Sizi Allahın yolundan sapdıracaq yollara uymayın. Allah bunları sizə tövsiyə etdi ki, bəlkə pis əməllərdən çəkinəsiz».*** *(əl-Ənam 153)* . Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Uca Allah doğru və düz bir yolu misal çəkdi. Bu yolun hər iki tərəfində açıq qapıları olan divar vardır. Qapıların üzərində endirilmiş pərdələr vardır. Yolun qapısı üzərində bir dəvətçi səsləyərək: «Ey insanlar! Birlikdə doğru yolla gedin. Ayrılığa düşməyin» deyir. Yolun üst tərəfində də bir dəvətçi bu açıq qapılardan içəri girmək istəyən hər bir kəsi səsləyərək: «Vay sənin halına! O, qapını açma. Əgər onu açsan ora girəcəksən» deyir. Bu doğru yol İslamdır. Ətrafda olan divarlar Allahın sərhədləridir. Açıq qapılar isə Allahın haramlarıdır. Yolun başında olan dəvətçi Allahın kitabıdır. Yolun üstündə olan dəvətçi isə hər bir müsəlmanın qəlbində olan nəsihətçidir» .

## ƏHLİ SÜNNƏ VƏL CƏMAATIN BƏZİ XÜSUSİYYƏTLƏRİ

1. Əhli Sünnə istər etiqad, istər əhkam, istər yaşayış baxımından ifrat və təfrit arasında vasat və itidal üzərə olanlardır. O, halda bu ümmət digər ümmətlər arasında vasat olduğu kimi onlar da bu ümmətin firqələri arasında vasat olanlardır. Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu:

---

[30] Tirmizi 2165, Həkim «Müstədrək» 1/114, İmam Əhməd «Musnəd», əl-Albani – İbn Əbu Asimin «əs-Sünnə» əsərində səhih olduğunu qeyd edir.
[31] əl-Albani «Səhih Sünnən Tirmizi».
[32] İbn Kəsir «Təfsir» 1/390.
[33] Əhməd «Musnəd» 4/278-375, əl-Albani həsən.
[34] İmam Əhməd «Musnəd» 1/435,465, Nəsai 10/95 h. 11109, Darimi 1/60, əl-Albani «Ziləlul Cənnə» 1/5 H. 17. Sələfi Salihin, Əhli Sünnə vəl Cəmaat haqqında geniş məlumata Nasir AbdulKərim əl-Əqlin «Məhfumu Əhli Sünnəti vəl Cəmaat» adlı əsərinə baxa bilərsiniz.
[35] İmam Əhməd «Musnəd» 4/182-185, 5/435, əl-Albani səhih.

«Asanlaşdırın, çətinləşdirməyin. Sevdirin, nifrət etdirməyin» . Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Çox şişirtməkdən çəkinin. Sizdən əvvəlkiləri çox şişirtmək məhv etdi» . Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «İfrata varanlar həlak oldular və bunu 3 dəfə təkrar etdi» .

2. Dinin hökmlərini yalnız Kitab və Sünnətdən götürürlər. Bunlara üstünlük verirlər. Nasslarına təslim olub, bunlardan öyrənirlər. ***«Aralarında hökm vermək üçün Allahın və Peyğəmbərinin yanına çağrıldıqları zaman möminlərin sözü ancaq eşiydik və itaət etdik deməkdən ibarətdir. Nicat tapanlar da məhz onlardır».*** *(ən-Nur 51).*

3. Onların Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – dən başqa təzim etdikləri hər hansı bir imamları yoxdur. Peyğəmbərin hallarını, sözlərini və əməllərini insanlar arasında ən yaxşı bilənlər onlardır. Buna görə də insanlar arasında Sünnəni ən çox sevən, ona tabe olmaq üçün ən çox səyy göstərən və bu sünnət əhlini də ən çox sevən də onlardır.

4. Dinə görə düşmənçiliyi tərk edərlər, düşmənçilik etməkdən uzaq olarlar. Halal və haram məsələsində mübahisəni bir kənara qoyarlar. ***«Yaxşılıq etməkdə və pis əməllərdən çəkinməkdə əlbir olun. Günah iş görməkdə və düşmənçilik etməkdə bir-birinizə kömək göstərməyin. Allahdan qorxun. Həqiqətən Allahın əzabı şiddətlidir».*** *(əl-Maidə 2).*

5. Sələfi Salihi təzim edər, elmə ən uyğun və möhkəm olduqlarına inanırlar.

6. Təvili qəbul etməzlər, şəriətə təslim olarlar, bununla bərabər nəqli ağıldan üstün tutarlar və ikincinin birinciyə boyun əyməsini söyləyərlər. Ağlı dəyərləri kiçiltməzlər. Onlara görə ağıl təkmilin qaynağıdır. Ağıl şəriətin önünə keçməz. Əksi təqdirdə insanların Peyğəmbərlərə ehtiyacları olmazdı. Ağıl şəriətin çərçivəsi içərisində fəaliyyət göstərməlidir.

7. Haqq üzərə yeriyirlər. Allaha təvəkkül etməklə yanaşı səbəblərdən yapışırlar. Dünya nemətlərini əldə edərkən dünyaya qarşı zahid olarlar. Qorxu və ümüd, sevgi və nifrət duyğularını birlikdə daşıyırlar. Möminlərə qarşı mərhəmətli və yumşaq olmaqla yanaşı, kafirlərə qarşı sərt və şiddətli olurlar. Zaman və məkanın dəyişməsi ilə birlikdə dəyişilməyən haqqa hidayət edən və doğru yolu göstərən salehlərin öndərləridirlər.

8. Onlar İslam, Sünnə və Camaatdan başqa hər hansı bir isim almazlar.

9. Səhih əqidəni, doğru dini yaymağa, bunları insanlara öyrədib qəlbən onlara nəsihət edən, onların işləri ilə maraqlanmağa əsas verirlər.

10. Camaata, qaynaşmağa çox səyy göstərirlər. Buna dəvət edər, insanları buna təşviq edərlər. Ayrılığı, təfriqəçiliyi bir kənara buraxarlar, insanları bundan çəkindirərlər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnsanlarla ünsiyyətdə olub onların zülmünə məruz qalan mömin, insanlarla ünsiyyətdə olmayıb onların əzabına məruz qalmayan mömindən daha xeyirlidir» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnsanlar arasında ən ağır bəlalara məruz qalan Peyğəmbər-lərdir. Sonra onlara oxşamaq istəyənlər, sonra yenə də onlara oxşamaq istəyənlər. İnsan dininə görə bəlaya məruz qalır. Əgər dini sağlamdırsa bəla da

---

[36] Buxari.
[37] Əhməd 1/215, Nəsai 5/268, 4063, İbn Məcə 3029, Həkim 1711, əl-Albani "Səhihul Cəmİ" 2680.
[38] Müslim 2670, Əbu Davud 4608, Əhməd 1/386, Əbu Yəla 5004.
[39] ***Nass*** - Quran və Sünnə (ayə və hədis) deməkdir.
[40] Əhməd, Tirmizi, İbn Məcə.

ağırlaşır. Əgər dinində bir incəlik varsa dininə görə bəlaya məruz qalır. Bəla insana yer üzündə heç bir günah buraxmadan yürüyəcək hala gəlincəyə qədər quldan ayrılmaz» .

11. İnsanların sözlərinə, inanclarına və dəvətlərinə qarşı insanlar arasında ən səbr edənlərdir. ***«Rəhmanın bəndələri o, kəslərdir ki, onlar yer üzündə təmkinlə, təvəzökarlıqla gəzər və cahillər onlara söz atdıqları zaman onlara: Salam – deyərlər».*** *(əl-Furqan 63).*

12. Uca Allah onları bir-birilərini təkfir etməkdən qorumuşdur. Başqaları haqqında da elmə, ədalətə uyğun olaraq hökm verərlər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir kimsə başqasını fasiqlikdə və ya kafirlikdə ittiham edərsə əgər o, kimsə belə deyilsə mütləq o, söz ona geri dönər» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir kimsə belə olmadığı halda başqa bir kimsəni kafir vəya ey Allahın düşməni deyə çağırarsa bu söz mütləq onu söyləyənə geri dönər» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim bir mömini küfürdə ittiham edərsə bu onu öldürmək kimidir» . Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «İsrail oğulları arasında qardaşlıq münasibəti qurmuş iki kimsə vardır. Bunlar biri günah işlər görər, digəri isə böyük bir həvəslə ibadət edərdi. İbadət edən kimsə digərini günah edən an gördükdə dayanıb ona nəsihət verərək: «Bu günahdan əl çək» deyərdi. Bir gün yenə də onun günah işlədiyini görüncə ona: «Bu günahdan əl çək!» dedi. O isə: «Məni Rəbbimlə tək burax (mən bilərəm, Rəbbim bilər). Sən mənim üzərimə gözətçi göndərilməmisən?» dedikdə ibadət sahibi: «Allaha and olsun ki, Allah səni bağışlamayacaqdır (Allah səni Cənnətə salmayacaqdır) deyərkən ruhları alındı. Hər ikisidə bir yerdə aləmlərin Rəbbinin hüzurun-da həşr olundular. Allah ibadət edən kimsəyə: «Sən Məni dərk edib tanıyan birisisənmi? Yoxsa ki, mənim əlimdə olanlardan xəbərdarsan? Günahkar kimsəyə isə: «Rəhmətimlə Cənnətə gir» deyə buyurdu. İbadət edən kisə üçün: «Götürün bunu Cəhənnəm atəşinə atın» deyə buyurdu. Əbu Hureyrə: «O, kimsə dünyasını da, axirətini də məhv edən bir söz söyləmişdir» .

13. Bir-birilərini sevərlər, bir-birilərinə qarşı mərhəmətlidirlər. Öz aralarında yardımlaşarlar, bir-birilərini tamamlayarlar. Ancaq dini əsaslarla bağlı olaraq başqalarını dost və ya düşmən bilərlər. ***«Onunla birlikdə olanlar*** *(mömінlər)* ***kafirlərə qarşı sərt, bir-birinə*** *(öz aralarında)* ***isə mərhəmətlidirlər».*** *(əl-Fəth 29).*

14. Sələfi Salihin əqidəsi müsəlmanı Uca Allaha və Onun Rəsuluna bağlayır. Onlara sevgi ilə bağlar və onları təzim edər. Allah və Rəsulundan qabağı keçməməyi öyrədir. Çünki Sələfin əqidəsinin əsası hava və şübhələrin oyuncağı olmaqdan uzaq bir şəkildə: «Allah buyurdu!», «Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu!» əsasıdır. Fəlsəfə, məntiq, kəlam və s. kimi yad şeylərə yönəlməkdən uzaqdırlar.

15. Bu əqidə müsəlmanı birləşdirir, səfflərini gücləndirir, haqq üzərə və haqda söz birliyi etmələrini əmr edir. ***«Hamınız bir yerdə Allahın ipindən möhkəm yapışın, bir-birinizdən ayrılmayın!»*** *(Ali İmran 103).*

16. Bu əqidə asantdır, başa düşüləndir və açıq-aydındır. Qarışıqlıq yoxdur. Başa düşülməz ifadələr yoxdur. Nassların təhrif edilməsindən uzaqdırlar. Belə bir əqidəyə inanan kimsənin qəlbi rahatdır. Ruhu hüzur içindədir. Şəkk-şübhə və şeytanın

---

41 Tirmizi «Zuhd» 57, İbn Məcə «Fitən» 23, əl-Albani «Səhih Silsilə» 147.
42 Buxari.
43 Müslim.
44 Buxari.
45 Səhih Sünnən Əbu Davud, əl-Albani səhih.

vәsvәsәsindәn uzaqdır. Gözü açıqdır. Çünki bu әqidәyә inanan bir kimsә bu ümmәtin Peyğәmbәri, sәhabәlәrinin göstәrdiyi yol üzәrindә yürümәkdәdir.

17. Bu әqidә Uca Allaha yaxınlaşmağı, Onun rizasını әldә etmәyin әn böyük sәbәblәrindәndir.

Əhli sünnә insanlar arasında elmlәri әn gözәl olanlar. Uca Allaha itaәt etmәklә nәfslәrini tәmizlәmәyә әn çox sәyy göstәrәnlәrdir. Bu xüsusiyyәtlәr Əhli Sünnәdә dәyişmәz xüsusiyyәtlәrdir. Hәr yer vә hәr zamanda bu xüsusiyyәtlәrdә fәrqlәr olmaz. Uca Allaha hәmd olsun.

# İSLAM

***İslam* –** sözdә «***әl-İslam***», «***әl-İstislam***» itaәt etmәk, bağlanmaq demәkdir . Şәriәtdә isә Tövhid ilә Allaha tәslim olmaq, itaәt ilә boyun әymәk, şirkdәn vә şirk әhli olan müşriklәrdәn uzaq olmaq demәkdir. ***«Yaxşı әmәl sahibi olub özünü Allaha tәslim*** *(İslam)* ***edәn, İbrahimin hәnif millәtinә*** *(dininә)* ***tabe olan şәxsdәn din etibarilә daha gözәl kim ola bilәr».*** *(әn-Nisa 125).* ***«Yalnız ona tәslim olub itaәt edin».*** *(әl-Hәcc 34).* ***«Kim yaxşı әmәl sahibi olub özünü Allaha tәslim edәrsә, o artıq әn möhkәm bağdan yapışmış olur».*** *(Loğman 22).*

Şirkdәn uzaq olmaq ondan uzaq olmaq demәkdir. Bu isә şirk әhli olan müşriklәrdәn uzaq olmaqla olur. ***«İbrahim vә onunla birlikdә olanlar sizin üçün gözәl örnәkdir». O zaman onlar öz qövmünә belә demişdilәr: «Şübhәsiz bizim sizinlә vә sizin Allahdan başqa ibadәt etdiklәrinizlә heç bir әlaqәmiz yoxdur. Biz sizin dininizi inkar edirik. Siz bir olan Allaha iman*** *(tәslim)* ***gәtirmәyincә bizimlә sizin aranızda hәmişә әdavәt vә nifrәt olacaqdır».*** *(әl-Mumtәhinә 4).*

Allahın bütün insanlardan iman etmәsini әmr etdiyi İslam, bütün Peyğәmbәrlәrin dә iman etdiyi tәk dindir. İtaәt vә tәslimiyyәt göstәrәn isә müsәlman adlanır. ***«İbrahim nә Yәhudi, nә dә Xristian idi. O, ancaq Hәnif müsәlman*** *(Allaha tәslim olan)* ***idi vә Allaha şәrik qoşanlardan deyildi».*** *(Ali-İmran 67).* ***«Xatırla ki, o zaman hәvvarilәrә:*** *(İsanın on iki әshabәsinә)* ***«Mәnә vә Peyğәmbәrimә iman gәtirin!» deyә әmr etmişdim. Onlar isә: «Bizim müsәlman olmağımıza şahid ol!» deyә cavab vermişdilәr.*** *(әl-Maidә 111).* ***Rәbbi İbrahimә: «Tәslim ol!» dedikdә, İbrahim dә: «Alәmlәrin Rәbbinә tәslim oldum» - deyә cavab vermişdi.*** *(әl-Bәqәrә 131).* *«(İbrahim vә İsmail)* ***Ey Rәbbimiz! Bizim hәr ikimizi sәnә itaәtkar*** *(müsәlman)*, ***nәslimizdәn yetişәnlәri sәnә tәslim*** *(İslam)* ***olan ümmәt et».*** *(әl-Bәqәrә 128). (Bir zamanlar Nuh belә demişdir)* ***«Mәnә müsәlmanlardan olmaq әmr edilmişdir».*** *(Yunus 72).* ***İbrahim vә Yәqub bunu öz oğlanlarına vәsiyyәt edib: «Ey oğlanlarım, hәqiqәtәn Allah sizin üçün*** *(belә bir)* ***din*** *(İslam dini)* ***seçdi, siz dә ancaq müsәlman olaraq ölmәlisiniz».*** *(әl-Bәqәrә 132).* ***Musa dedi: «Ey qövmüm! Əgәr Allaha iman gәtirmisinizsә vә müsәlman olmusunuzsa, ona tәvәkkül edin».*** *(Yunus 84).*

Ayәlәrә nәzәr saldıqdan sonra görürük ki, Allahın göndәrdiyi ilk Rәsuldan düz son Rәsula qәdәr bütün Peyğәmbәrlәr Allaha tәslim (İslam) olmuş vә onların dinlәri dә İslam adlandırılmışdı. Peyğәmbәrlәrinә tabe olanlar isә onların dövründә müsәlman

---

[46] «Lisәnul-Ərab» 12/293.

[47] ***Hәnif* -** Əbu Hәnifә – *rahmәtullahi aleyhi* – deyir ki: «***Hәnif* –** haqq üzәrindә düz yeriyәn vә ona uyan kimsә demәkdir. Bütün dinlәrdәn üz çevirәrәk haqqa yönәlәn kimsәdir». «Lisanul-Ərab» 9/157, «İbn Kәsir tәfsir» 1/186,187, «Muhtarus-Sihah» s. 159. Digәr bir tәrif: «Şirkdәn uzaq olan, Allaha ixlas üzәrindә bina edilmiş dinin adıdır». «Uç әsas» Seyx Useymin – *rahmәtullahi aleyhi* – nin şәrhi ilә.

idilər. Məs: Xristianlar İsa – *əleyhissəlam* - ın dövründə, Yəhudilər Musa – *əleyhissəlam* - ın dövründə müsəlman idilər. Lakin İslam, son Peyğəmbər Muhəmməd - *sallallahu aleyhi və səlləm* - gəldikdən sonra Allah bütün bu dinləri nəsx etmiş və onlar Muhəmməd - *sallallahu aleyhi və səlləm* - i inkar etdiklərinə görə artıq müsəlman deyildilər. Çünki hər bir göndərilən Peyğəmbər öz qövmünü, tayfasını və ya öz dövlətini qorxutmaq (Allahın əzabı ilə) və müjdələmək (Allahın Cənnəti ilə) üçün göndərilmişdir. ***«Biz Peyğəmbərləri müjdə verən və əzabla qorxudan kimi göndərdik ki, daha insanlar üçün Peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın. Allah yenilməz qüvvət və hikmət sahibidir».*** *(ən-Nisa 165).*

Muhəmməd - *sallallahu aleyhi və səlləm* - isə bütün bəşəriyyətə göndərilmişdi. ***«Biz səni aləmlərə rəhmət olaraq göndərdik».*** *(əl-Ənbiya 107).* Hədislərə gəlincə Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurmuşdu: «İstər Yəhudi, istər Xristian olsun mənim Peyğəmbərliyim haqqında eşidib və mənə iman etməzsə mütləq Cəhənnəm atəşini dadar» . Buna görə də Yəhudi və Xristianlardan qurtuluş istiyənlər İslama girərək, İslam Peyğəmbəri Muhəmməd - *sallallahu aleyhi və səlləm* – ə tabe olmaq məcburiyyətindədirlər. Ancaq bu şəkildə, Allahın salat və salamı onların üzərinə olsun Musa, İsa və Muhəmməd – *əleyhimussəlam* – a həqiqi şəkildə itaət etmiş olarlar.

Maraqlı burasıdır ki, bu dinin adı nə bir tayfa, nə bir insan, nə də bir dövlət adı ilə bağlıdır. Necə ki, digər dinlərin adlarına nəzər salsaq, Xristianlıq İsa – *əleyhissəlam* - ın adından, İudaizm İuda adlı tayfadan, Buddizm Quatama Budda adlı şəxsin adından, həmçinin Konfusianizm Konfusianın adından, Marksizm Karl Marksın adından götürülmüşdü. Yeganə İslam dinidir ki, bu sadaladıqlarımızdan heç birinə məxsus deyildir. Çünkü bu adı ona Allah vermişdi. ***«Allah dərgahında din, əlbəttə ki, İslamdır».*** *(Ali-İmran 19).*

İslam dinidir ki, Allahın dərgahında qəbul edilən və qəbul edənə fayda verəndir. ***«Kim İslamdan başqa bir din ardınca gedərsə heç vaxt ondan qəbul olunmaz və o şəxs axirətdə zərər çəkənlərdən olar».*** *(Ali-İmran 85).* ***«Necə ola bilər ki, onlar*** *(kitab əhli)* ***Allahın dinindən başqa bir din axtarsınlar? Halbuki, göylərdə və yerdə olanların hamısı istər-istəməz ona*** *(Allaha)* ***təslim olmuşlar və onun hüzuruna qayıdacaqlar».*** *(Ali-İmran 83).* İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Rəsulların hamısı Allahın dini olan İslamı təbliğ etməklə əmr olunaraq göndərilmişlər. İslam, Allahın nə ilk insanlardan, nə də onlardan sonra gələcək olanlardan ondan başqa heç bir dini qəbul etməyəcəyi tək haqq dinidir. Rəsullardan bizə gələn səməvi mutəvatir kitablarda xəbər verildiyinə görə Allah insanlardan hənif din olan İslamdan başqa heç bir dini qəbul etməyəcəkdir. Allahın bütün insanlara göndərdiyi, Rəsulların hamısına əmr etdiyi Tövhiddir. O, da Rəsulların, üzərində ittifaq etdikləri İslam dinidir. Bu dinin əsli olan Tövhiddir, ədalətin ən ucasıdır. Əksi isə zülmlərin ən böyüyü olan şirkdir. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – sözünə davam edərək deyir: «Allahın dini olan İslam iki təməl üzərində qurulmuşdur. Heç bir şeyi Allaha şərik qoşmayaraq Ona ibadət etmək, bunu da Alahın Rəsulunun diliylə bizə bildirdiyi şəriət üzərə etmək. Bu da şəhadət kəliməsinin özüdür» .

---

[48] ***Nəsx –*** lüğətdə nəql etmək, axtarmaq deməkdir. ***İstilahi Mənası –*** şəri bir dəlilin hökmünü yaxud da ləfzini Kitab və Sünnətdən bir dəlil ilə qaldırmaq deməkdir. Hökmü qaldırmaq. «Usuli Fiqh» Şeyx Useymin.
[49] Müslim.
[50] Fətva əl-Kubra 1/335, 348, əl-Ubudiyyə s. 34.

İslam dinidir ki, Allah onu Muhəmmədə və ümmətinə lütf etmişdir. ***«Bu gün dininizi tamamlayıb mükəmməl etdim, sizə olan nemətimi başa çatdırdım və bir din kimi sizin üçün İslamı bəyənib seçdim».*** *(əl-Maidə 3).*

İslam dininin mərtəbələri, rukunları haqqında bizə (müsəlmanlara) məlumatı Rəsulullah - *sallallahu aleyhi və səlləm* - ın sünnəsində varid olunmuş Cəbrail – *əleyhissəlam* - ın hədisi xəbər verir. Ömər – *radıyallahu anhu* - rəvayət edir ki, bir gün Rəsulullah - *sallallahu aleyhi və səlləm* - in hüzurunda oturmuşduq. Bu vaxt paltarı dümağ, saçları olduqca qara, üzərində səfər əlaməti görünməyən və aramızda heç kimin tanımadığı bir nəfər icəri girib, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in yanında oturdu. İki dizini onun dizlərinə söykəyib, əllərini dizlərinin üstünə qoyaraq dedi: «Ey Muhəmməd, mənə İslam haqqında xəbər ver». Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «İslam, Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına, Muhəmmədin Allahın Rəsulu olduğuna şəhadət etmək, namaz qılmaq, zəkat vermək, Ramazanda oruc tutmaq, Beyti imkan olduqda həcc etmək». (Adam): Doğru söylədin, dedi. (Ömər) dedi: «Adama heyrət etdik. Həm ona sual verir, həm də onun söylədiklərini təsdiq edirdi». (Yenə) soruşdu: «Mənə İman haqqında xəbər ver». (Peyğəmbər) buyurdu: «(İman) Allaha, Mələklərinə, Kitablarına, Peyğəmbərlərinə, Axirət gününə və xeyir və şərin Allahdan olmasına inanmaqdır». (Adam): «Doğru söylədin» dedi. Bu dəfə «Mənə Ehsan haqqında xəbər ver». (Peyğəmbər) buyurdu: «(Ehsan) Allahı onu görmüş kimi ibadət etməkdir. Lakin sən onu ğörməsən də, o, səni görür». (Adam): «O halda mənə Qiyamət saatı haqqında xəbər ver». Rəsulullah: «Soruşulan soruşandan cox bilmir». (Adam): «Onda mənə onun əlamətləri haqqında xəbər ver». (Peyğəmbər) buyurdu: «Qul qadın öz ağasını doğması, ayaq yalın, çılpaq, cobanların hündür bina tikməkdə bir-birləri ilə yarışmaları». (Ömər) dedi: Sonra o adam durub getdi». Bir müddətdən sonra (Peyğəmbər) mənə buyurdu: «Ey Ömər, o sual verənin kim olduğunu bilirsən?» Allah və Rəsulu daha gözəl bilir. (Peyğəmbər) buyurdu: «O, Cəbrail – *əleyhissəlam* - idi. Sizə dininizi öyrətməyə gəlmişdi» . Həmçinin Əbu AbdurRəhman b. Ömər b. əl-Xəttab – *radıyallahu anhu* – rəvayət edir ki, mən Rəsulullah - *sallallahu aleyhi və səlləm* - in belə buyurduğunu eşitdim. «İslam beş təməl üzərində bina edilmişdi. Allahdan başqa ibadətə layiq haqq ilahi olmadığına və Muhəmmədin Allahın Rəsulu olduğuna şəhadət gətirmək, namaz qılmaq, zəkat vermək, Beyti həcc etmək və Ramazan ayının orucunu tutmaq» . Bu hədislərdən göründüyü kimi İslam zahiri əməlləri əhatə edir. Şəhadət kəlməsini dil ilə söyləmək dilin əməli, namaz, oruc, həcc bədənin, zəkat isə malın əməlidir. Buna görə də İslam dini üç mərtəbədən ibarətdir.

**1. *İslam*. 2. *İman.* 3. *Ehsan.***

Hər bir mərtəbənin də öz rukunları vardır.

İslam haqqında çox geniş danışmaq olar, lakin mən, hörmətli bacı və qardaşlarım, ilk öncə özümə, sonra da sizə İslam dinini gözəl bir şəkildə öyrənməyinizi və bu dindən möhkəm yapışmağınızı tövsiyə edirəm. Çünkü Rəsulullah - *sallallahu aleyhi və səlləm* - bu dində olanların dünya və axirətlərinin xoşbəxt olması ilə bizi müjdələmişdi. Əbu Hureyrə, İbn Ömər – *radıyallahu anhum* – dən gələn rəvayətdə Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurur: «İslam qərib olaraq başladı, başladığı kimi yenə

---

[51] Buxari, Müslim.
[52] Buxari, Müslim.

də qəribliyə dönəcəkdir. Xoşbəxtdir o qəriblər» . Başqa rəvayətdə: «Qəriblərə mücdə olsun! Onlar say etibarı ilə pis adamların içərisində olan, saleh kimsələrdir (azlıq təşkil edənlərdir). Onlara qarşı gələnlər, onlara itaət edənlərdən daha çoxdur» . Allah bizi də onlardan etsin.

## ŞƏHADƏT

***Şəhadət*** – bir şey haqqında bilərək xəbər vermək, onun doğru olduğunu və sabit olduğuna inanmaq deməkdir. İqrar və itaət, qəlb və dil bir-birinə müvafiq olmadıqca şəhadət mötəbər sayılmaz. Çünkü Allah münafiqlərin söylədiklərini: ***«****(Ya Peyğəmbər)* ***Münafiqlər sənin yanına gəldikləri zaman: Biz sənin doğrudan da Allahın Peyğəmbəri olduğuna şəhadət veririk!».*** *(əl-Münafiqun 1).* Onlar bu kəlməni yalnız dilləri ilə söylədikləri üçün Allah onları yalançı adlandırmışdı. ***«Allah da sənin onun həqiqi Peyğəmbəri olduğunu bilir. Allah həm də münafiqlərin xalis yalançı olduqlarına şəhadət verir».*** *(əl-Münafiqun 1)* .

Şəhadət kəlməsi özü-özlüyündə onu açıqlayır ki, onu söyləyən hər bir kəs yalnız elmi, yəqinliyi, ixlası və səmimiyyəti əsnasında bu kəlməni söyləmiş olur. Bu xüsusiyətlərin olamaması şəhadət kəlməsini etibarsız edir. Şəhadət elm üzərində olan bir kəlimədir. Dünyəvi məsələlərdə insan bir şeyə şahidlik etdikdə bildiyi şeyə şahidlik edər. Bilmədiyi bir şeyə şəhadət edərsə bu – Yalançı şəhadət adlanır. Bu şəhadəti insanlar da qəbil etməzlər. Şəhadəti deyən insan Allaha söz verir ki, mən Səndən başqa heç kəsə ibadət etməyəcəyəm. Əgər o, bu sözünə əməl etməzsə: «Ya filankəsin cəddi!», «Ya filankəs!» deyərsə onda bu söz pozular. Şəhadət Kəliməsinin fayda verməsi üçün insan iki şeyi bilməlidir.

**1.** ***Şəhadət Veriləni*** – Allahı tanımaq. Bu da özü-özlüyündə iki şeyi əhatə edir. 1) Ümumi tanımaq. 2) Təfsilatı ilə tanımaq.

***Əşhədu*** – elmlə deyilən bir sözdür. Bu da bəsirət, göz və xəbərnən əldə edilən bir elmdir. Osman – *raıyallahu anhu* - rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Hər kim Allahdan başqa ibadətə layiq haqq ilah olmadığını bilərək ölərsə Cənnətə girər» . O, dediyi sözün düzgün olması üçün Allahı tanımaq lazımdır. Allah tək olduğuna, bənzəri olmadığına, oxşarının, şərikinin olmadığını bilməlidir. Allah ***Saməddir*** – ehtiyacsız, möhtac deyildir. Allah yeməyə, içməyə, rahatlığa ehtiyacı yoxdur. Bütün məxluqat Allaha möhtacdır. Allaha zəiflik, xəstəlik, yuxu, ölüm və s kimi naqisliklər üz vermir. Allah doğmayıb, doğulmayıb, yoldaşı da yoxdur. Allah aləmlərin Rəbbidir. Bütün mülk onun əlindədir. Əmr etmək də, yaratmaq da ona aiddir. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – bu kəlməni belə izah edir: «***İlah*** – ibadət və itaət olunandır. İlahlaşdırılan da yalnız ibadətə layiq olandır. Çünki o, elə bir xüsusiyyətlərə malikdir ki, istər-istəməz onu yüksək məhəbbətlə sevmək və ona itaət, ibadət etmək qaçınılmazdır. ***İlah*** – nə ki, sevilir, ibadət edilir və qəlblərin (ürəklərin) ona olan məhəbbətindən ilahlaşdırılır. Ona itaət edirlər və onun qarşısında alçalırlar. Ondan qorxurlar və onu arzulayırlar (istəyirlər). Bəlada ona sarı qaçırlar və mühüm məqamlarda duaları ona yönəldirlər. Ruzi intizarında ona təvəkkül edilir və ondan sığınacaq istənilir. Onun adı zikr olunanda sakitləşirlər və ona olan məhəbbətdən

---

[53] Müslim.
[54] əl-Albani «Səhihul Cəmius Səğir» 1/12, 3816.
[55] «əl-Əqidətul-Vasitiyyə» İbn Teymiyyə.
[56] Müslim.

rahatlıq tapırlar. Allahdan başqa ibadətə layiq heç bir haqq ilah yoxdur». Artıq insan bunu bilərsə o, şəhadət dedikdə kimə şəhadət etdiyini bilər. Az da olsa o, Allahı başqa ibadət olunan ilahlardan ayıra bilməlidir. (Görürsən ki, insan ***Lə İləhə İlləllah*** deyir, lakin Allahdan qeyrisindən kömək diləyir, qurban kəsir, nəzir diyir və s. Deməli bu insan hələ də ***Lə İləhə İlləllah*** kəliməsini başa düşməyib). Az bir bilik ilə onunla əqidəsi düzgün olar, əməli qəbul olar. Bu kəlimə də ondan qəbul olunar. İnsan bu ümumi bilgi ilə İslam dininə daxil olur. Lakin insan bu bilgi ilə kifayətlənməməli. Mütləq o, bilgisini artırmalı və Allahı geniş surətdə tanımalıdır. Allahın İsim və Sifətlərini bilməlidir ki, bununla da imanı artsın.

**2.** Şəhadət Kəliməsinin mənasını bilməli və səndən tələb etdiyi şeyləri bilməlisən. ***«Allah özündən başqa heç bir ilah olmadığına şahiddir. Mələklər və elm sahibləri də haqqa-ədalətə boyun qoyaraq o qüvvət və hikmət sahibindən başqa ibadətə layiq heç bir ilah olmadığına şəhadət verdilər».*** *(Ali-İmran 18).* Bu ayədən göründüyü kimi Allah özü haqqında şahidlik etdikdə ki, ondan başqa heç bir haqq ilah yoxdur, Mələklər və Elm sahibləri də şahidlik etdilər. Bu şahidlik ən böyük şəhadətdir. Çünkü şəhadət kəlməsi sayəsində hər bir kəsin malı və qanı qorunmuş, himayə altına alınmış olur. İbn Ömər – *radıyallahu anhu* - rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına və Muhəmmədin Allahın Rəsulu olduğuna şəhadət edincə, namaz qılınca, zəkat verincəyə qədər insanlarla vuruşmağa əmir olundum. Bunu etdilərmi, öz qanlarını və mallarını məndən qorumuş olurlar. İslamın haqqı ilə olması müstəsna. Haqq-hesablarını çəkmək isə Allaha aiddir»[57].

Şəhadət kəlməsi ilə Allah bizə əmr etdiyi əməlləri qəbul edir, onunla Cənnətə girmək və Cəhənnəmdən qurtarmaq olar. ***«Ayələrimizi yalan hesab edənlərə və onlara təkəbbürlə yanaşanlara göyün qapıları açılmaz və dəvə iynənin gözündən keçməyənə qədər onlar da Cənnətə daxil ola bilməzlər».*** *(əl-Əraf 40).* Nə qədər günahlar böyük olursa olsun onun səbəbi ilə bağışlanılır.

İlkindən sonuncusuna qədər bütün Peyğəmbərlərin dəvət etdikləri, hətta dəvətlərinin özəyi və işlərinin başı da bu olmuşdu. Son Rəsulumuz Muhəmməd - *sallallahu aleyhi və səlləm* – də Məkkədə 13 il yalnız bu kəlməyə dəvət etmiş və insanlara onun nə qədər mühüm olduğunu açıqlamağa çalışmışdı. *«(Ya Muhəmməd!)* ***Söylə ki, Ey kitab əhli, sizinlə bizim aramızda eyni olan bir kəlməyə tərəf gəlin! Allahdan başqasına ibadət etməyək. Ona şərik qoşmayaq və Allahı qoyub bir-birimizi*** *(özümüzə)* ***Rəbb qəbul etməyək! Əgər onlar yenə də üz döndərərlərsə, o zaman*** *(onlara)* ***deyin: İndi şahid olun ki, biz həqiqətən müsəlmanlarıq.*** *(Allaha təslim olanlarıq)». (Ali-İmran-64).*

## LƏ İLƏHƏ İLLƏLLAH - *Allahdan Başqa İbadətə Layiq Haqq İlah Yoxdur –*

Ümumən Allah – *subhənəhu və təalə* – kitabları – ***Lə İləhə İlləllah*** – görə nazil edib, Peyğəmbərləri – ***Lə İləhə İlləllah –*** görə göndərib, bizim yaradılışımızda – ***Lə İləhə İlləllah –*** görədir, cihadıda - ***Lə İləhə İlləllah*** – görə fərz edib. Əsas da elə

---

[57] Buxari, Müslim.

budur. Bu kəliməni bilmək və səndən tələb etdiyi şeyləri yerinə yetirmək. Əgər əsas möhkəm və düz olarsa onun üzərində qurulan hər bir şeydə möhkəm və düz olar .

***Lə İləhə İlləllah –*** «Allahda başqa ibadət edilməyə layiq heç bir haqq ilah yoxdur» deməkdir. ***«Bil ki, Allahdan başqa ilah yoxdur».*** *(Muhəmməd 19).* ***«Allahdan başqa heç bir ilah yoxdur».*** *(Ali-İmran 2).* Bütün bu ayələrin mənası ibadət edilməyə haqq edən yalnız və yalnız Allahdır. Bu ifadə ilə Allahdan başqa ibadət olunan hər hansı bir ilah rədd edilmuş olur. Allahdan başqa ifadəsi ibadətin yalnız Allaha edilməsi, mülkündə heç bir ortağı olmadığı kimi, ibadətdə də onun hər hansı bir ortağı (şəriki) olmadığıdır.

***Lə İləhə İlləllah*** **-** kəlməsi nəfy və isbatdan ibarətdir. ***Lə İləhə –*** ilah yoxdur nəfy, ***İlləllah –*** Allahdan başqa isbat etməkdir.

***İlah*** **-** məbud ibadət ediləndir. Ancaq ilah olan məbuddur. Hər bir kəsin ilahı, ona ibadət etdiyidir. Allahdan başqa ibadət olunan bu ilahlar, ilahdır. Lakin batil ilahlardır. Çünkü bunlar haqq ilah deyillər. ***«Bu belədir. Çünki Allah haqq, müşriklərin ondan başqa ibadət etdikləri*** *(bütlər, tanrılar)* ***isə batildir. Həqiqətən Allah uca və böyükdür».*** *(əl-Həcc 62).* ***«Bu ona görədir ki, Allah haqq,*** *(müşriklərin)* ***ondan qeyri ibadət etdikləri isə batildir».*** *(Loğman 30).*

## LƏ İLƏHƏ İLLƏLLAH KƏLİMƏSİNİN ŞƏRTLƏRİ

***Lə İləhə İlləllah –*** kəlməsinin yeddi şərti var. Bu şərtlərin hər birinə əməl olunmadıqca, onların ifadə etdiyi mənaları Quran və Sünnəyə uyğun olaraq dolğun, düzgün başa düşülmədikcə, bu kəlmənin söylənilməsi heç bir kəsə fayda verməyəcəkdir. Vəhb b. Munəbbih – *rahmətullahi aleyhi* – dən: «***Lə İləhə İlləllah –*** cənnətin açarı deyilmidir?» deyə soruşan bir kimsəyə o, belə cavab vermişdir: «Bəli, lakin hər açarın dişləri vardır. Əgər dişli açar gətirərsənsə qapı sənin üzünə açılır. Yox, əgər açarın dişləri olmazsa qapı açılmaz» .

Aşağıda qeyd edəcəyimiz bu şərtlər Quran və Sünnəyə uyğun olaraq möhtərəm İslam alimləri tərəfindən qeyd olunmuşdu.

**1.** ***Elm*** – cahillikdən uzaq edən.
**2.** ***Yəqinlik*** – şübhələri yox edən.
**3.** ***Ixlas*** – şırkdən uzaq edən.
**4.** ***Məhəbbət*** – nifrətdən uzaq edən.
**5.** ***Sidq*** – yalanı yox edən.
**6.** ***Təslim*** – itaətsizliyi yox edən.
**7.** ***Qəbul*** – inkarı yox edən.

## ELM

Bu o, elmdir ki, ***Lə İləhə İlləllah*** **-** kəlməsini dəlillərlə öyrənir və isbat edir. Bu da dil ilə söyləyib qəlb ilə bilməkdir. Onun mənasını, nə qəsd etdiyini, nəyi inkar və nəyi təsdiq etdiyini bilmədən söyləyənə heç bir faydası olmaz. ***«Öyrən bil ki, Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur».*** *(Muhəmməd 19).* ***«Ondan qeyri ibadət etdikləri şəfaət edə bilməzlər. Haqqa şəhadət verənlər müstəsnadır».*** *(əz-Zuxruf 86).*

---

[58] Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – deyir ki: «Xəta üzərində bina edilən hər bir şey xətadır».
[59] ***Nəfy*** - İnkar etmək.
[60] Buxari «Cənaiz» 1, Əhməd 5/242.

Bu ayənin mənası odur ki, Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına dair şəhadət edərək dillərilə söylədiklərini qəlbləri ilə bilərək təsdiq etməlidirlər. ***«Mən həqiqətən Allaham. Məndən başqa heç bir ilah yoxdur».*** *(Ta ha 14).* Osman – *radıyallahu anhu* - rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Hər kim Allahdan başqa ibadətə layiq haqq ilah olmadığını bilərək ölərsə Cənnətə girər» .

## YƏQİNLİK

Bu kəliməni söyləyən kimsə tam mənasıyla bu kəlimənin nə məna kəsb etdiyində yəqin olmalı və heç bir şəkk-şübhəyə düşməməli, bu kəlimə haqqında tam bir bilik və qavrayış sahibi olmalıdır. ***«Möminlər yalnız Allaha və Peyğəmbərinə iman gətirən və iman gətirdikdən sonra heç bir şəkk-şübhəyə düşməyənlərdir. Allah yolunda malları və canları ilə vuruşarlar. Məhz belələri sadiq olanlardır».*** *(əl-Hucurat 15).* Əbu Hureyrə – *radıyallahu anhu* - rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Mən şəhadət edirəm ki, Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur və mən onun elçisiyəm. Kim bu iki şəhadətə şübhə etmədən Allahın hüzuruna gedərsə o, qul Cənnətə girər» .

## İXLAS

Əməllərini şirkdən təmizləmək, şirkə yer verilməyən bir ixlasa sahib olmaq. ***«Bil ki, xalis din yalnız Allaha məxsusdur».*** *(əz-Zumər 3).* ***«Halbuki, onlara əmr edilmişdir ki, Allaha dini yalnız ona məxsus edərək, digər bütün batil dinlərdən İslama dönərək ibadət etsinlər. Namaz qılıb, zəkat versinlər. Doğru-düzgün din budur».*** *(əl-Bəyyinə 5).* Əbu Hureyrə – *radıyallahu anhu* - rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Qiyamət günü mənim şəfaətimlə ən xoşbəxt insan o kəsdir ki, qəlbində ixlas ilə ***Lə İləhə İlləllah*** - kəlməsini deyəndir» . Əbu Hureyrə – *radıyallahu anhu* - rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - mənə buyurdu: «Bu divarın arxasında qəlbindən iman ilə Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına şəhadət edən hər kiminlə qarşılaşsan onu Cənnət ilə müjdələ» .

## SİDQ

Bu kəlməyə sadiq olmaq. Bu kəlməni qəlbdən gələn doğruluqla dilin söylədiklərini qəlb ilə təsdiq edərək söyləmək. ***«İnsanlar yalnız iman gətirdik deməkləri ilə onlardan əl çəkib imtahan olunmayacaqlarınımı sanırlar? Biz onlardan əvvəlkiləri də imtahana çəkmişdik. Şübhəsiz ki, Allah düz danışanları da yalançıları da çox gözəl tanıyır».*** *(əl-Ənkəbut 2-3).* ***«Haqqı gətirən və onu təsdiq edənlər isə əsl müttəqilərdir».*** *(əz-Zumər 33).* Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Qəlbindən doğruluq və səmimiyyət ilə Allahdan başqa ibadətə layiq haqq ilah

---

[61] Müslim 26.
[62] Müslim 27.
[63] Buxari 99.
[64] Müslim 31.

olmadığına, Muhəmmədin Allahın Rəsulu olduğuna şəhadət gətirən hər kəsə Allah Cəhənnəm odunu haram edər» .

## MƏHƏBBƏT

Bu kəlməyə məhəbbətlə bağlanmaq. Bu kəlmənin daşıdığı, gətirdiyi hər bir şeyi sevmək və bu kəlməni söyləyənləri – Muvahhidləri sevmək. ***«İnsanların içərisində Allahdan qeyrilərini Allaha şərik qoşub Allahı sevən kimi sevənlər də var. Halbuki, iman gətirənlərin Allaha olan məhəbbəti daha qüvvətlidir».*** *(əl-Bəqərə 165).* ***Ey iman gətirənlər! Sizdən hər kəs dinindən dönsə Allah onun yerinə elə bir tayfa gətirər ki, Allah onları, onlar da Allahı sevərlər. Onlar möminlərə qarşı mülayim kafirlərə qarşı sərt olarlar. Allah yolunda vuruşar və heç kəsin tənəsindən qorxmazlar. Bu Allahın lütfüdür, onu istədiyinə verər».*** *(əl-Maidə 54).* Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Üç şey var ki, sizlərdən kimdə olarsa o, imanın şirinliyini dadar. Allah və Rəsulunu hər şeydən çox sevmək, Allah rizası üçün bir-birinizi sevmək (sevdiyini ylnız Allah üçün sevən), Allahın küfrdən xilas etdiyi və sonra küfrə qayıtmaqdan oda atılmış kimi qorxan (şəxs)» . ***«Ey iman gətirənlər! Yəhudi və Xaçpərəstləri özünüzə dost tutmayın! Onlar bir-birinin dostudurlar. Sizdən kim onlarla dostluq edərsə, o da onlardandır. Allah zalim tayfanı düz yola yonəltməz! Sizin vəliniz*** *(dostunuz)* ***ancaq Allah, onun Peyğəmbəri və iman gətirənlərdir. O kəslər ki, boyun əyərək namaz qılar və zəkat verərlər».*** *(əl-Maidə 51-55).* ***Ey iman edənlər! Əgər atalarınız və qardaşlarınız küfrü imandan üstün tutarlarsa, onları özünüzə dost bilməyin. Sizlərdən onları dost tutanlar özlərinə zülm etmiş olarlar».*** *(ət-Tövbə 23).* ***«Ey iman gətirənlər! Nə mənim düşmənimi, nə də özünüzün düşmənini dost tutun».*** *(əl-Mumtəhinə 1).*

## TƏSLİM

***Lə İləhə İlləllah*** - kəliməsinə boyun əymək. Allahın qoyduğu bütün qayda–qanunlara, şəriət və sünnəyə əməl etmək. ***«Kim yaxşı əməl sahibi olub özünü Allaha təslim edərsə o, artıq ən möhkəm bağdan yapışmış olur. Bütün işlərin axırı Allaha gəlib çatacaqdır».*** *(Loğman 22).* ***«Tövbə edib Rəbbinizə dönün. Əzab sizə gəlməmişdən əvvəl ona təslim olun. Sonra sizə heç bir kömək olunmaz».*** *(əz-Zumər 54).* Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Sizdən heç bir kimsənin nəfsi-istəyi mənim gətirdiyimə tabe olmadıqca iman etmiş olmaz» .

## QƏBUL

Bu kəlimənin gətirdiyi hər bir şeyi qəbul edəcək, inkara əsla yol verməmək, Allaha ibadət etmək və şirki inkaretməkdir. ***«Onlara Allahdan başqa heç bir ilah yoxdur deyildiyi zaman təkəbbür göstərirdilər».*** *(əs-Saffət 35).*

Bu sadaladığımız şərtlər ***Lə İləhə İlləllah*** kəlməsinin ayrılmaz bir hissəsidir. Bu şərtlər üzərində düşünüb fikirləşmək, onlara lazımı qaydada əməl etmək isə sizin üzərinizə düşən bir haqdır. Çünki biz dünya və axirətimizi yalnız bu kəlməni öyrənib,

---

[65] Buxari 128, Müslim 32.
[66] Buxari 16, Müslim 43.
[67] İbn Həcər «Fəthul Bəri» 13/289, İbn Rəcəb «Cəmiul Ulumi vəl Hikəm» s. 338, İbn Əbi Asim «əs-Sünnə» 1/12,13.

ona düzgün əməl etməklə xoşbəxt və firavan edə bilərik. Ubədətu b. Samit – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Kim şəhadət etsə ki, Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur, Muhəmməd onun qulu və Rəsuludur, İsa – *əleyhissəlam* - onun qulu və Rəsuludur, Məryəmə dediyi söz və Ondan gəlmə bir ruhdur , Cənnət haqq, Cəhənnəm haqqdır, Allah o insanı əməlindən asılı olmayaraq (və ya olaraq) Cənnətə salar». Başqa rəvayətdə Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurur: «Cənnətin hansı qapısından istərsə, onu oradan içəri salar» . Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Musa – *əleyhissəlam* - öz Rəbbinə buyurdu: «Ey Rəbbim! Mənə elə bir kəlmə öyrət ki, səni onunla yada salım və dua edim». Allah buyurdu: «Ya Musa! De: «***Lə İləhə İlləllah***». Musa – *əleyhissəlam* - buyurdu: «Ya Rəbbim! Axı sənin bütün qulların bu kəlməni deyir». Allah buyurdu: «Ya Musa! Əgər yeddi qat göyü və yeddi qat yeri və məndən başqa orada olanları tərəzinin bir gözünə, ***Lə İləhə İlləllah*** kəlməsini tərəzinin digər bir gözünə qoysalar bu kəlmə ağır gələr» . Rəsulullah - *sallallahu aleyhi və səlləm* – buyurur: «Qiyamət günü mənim ümmətimdən bir nəfəri bütün insanların qarşısında çağıracaqlar. Onun qarşısına günahlarla dolu doxsan doqquz kitab qoyulacaq. Hər birinin uzunluğu gözün son görmə həddi qədər olacaqdır». Sonra ondan soruşacaqlar. «Sən bunlardan hansınısa inkar edirsənmi? Əməlləri yazan mələklər sənə zülm etdilərmi?». Qul: «Yox, Ya Rəbbim!» deyəcəkdir. Allah buyuracaq: «Səndə bunlara qarşı bir yaxşı əməl varmı?». Həmən şəxs qorxudan özünü itirərək: «Yox, Ya Rəbbim!» deyəcəkdir. Ona deyiləcək: «Bizdə sənin bir yaxşı əməlin vardır. Bu əməlinə görə bu gün sənə əsla zülm olunmayacaqdır». Onun qarşısına «Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına və Muhəmmədin Allahın qulu və Rəsulu olduğuna şəhadət edirəm» kəlməsi yazılmış vərəqə çıxarılacaqdır. Həmən qul deyəcəkdir: «Ya Rəbbim! Bu vərəq bu qədər günahların qarşısında nə gücə malikdir». Allah: «Bu gün sənə əsla zülm olunmayacaqdır». Günahları tərəzinin bir gözünə, həmən vərəqi isə tərəzinin o biri gözünə qoyacaqlar. Vərəqə olan tərəzi ağır gələcəkdir. Rəhman və Rəhim olan Allahın adı qarşısında heç bir şey ağır gəlməz» . Əbu Məlik – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* – buyrdu: «***Lə İləhə İlləllah*** deyib Allahdan başqa ibadət olunan hər bir şeyi inkar edən insanın canına, malına qəsd etmək haramdır. Onunla haqq hesabı Allah özü çəkəcəkdir» .

# TÖVHİD

Allah – *subhənəhu və təalə* - hər bir şeydə birdir. Zatında, əməlində, İsim və Sifətlərində də. İbadət edilməyə layiq olub, bu xüsusda tək haqq sahibi olmaqda da

---

68 ***Məryəmə Dediyi Söz*** – Allah İsa – *əleyhissəlam* – ı sözlə yaratdı. Hansı ki, Cəbrail – *əleyhissəlam* - ilə göndərmişdir. İsa – *əleyhissəlam* – ın ruhunu. İsa – *əleyhissəlam* - özü Allahın kəlamından deyildir. Allah buyurur: «***Ol!***» və o, olur. İmam Əhməd – *rahmatullahi aleyhi* – deyir ki: «İsa – *əleyhissəlam* – «***Ol!***» sözündən yaranmışdır. Allah buyurur: «***Ol!***» və İsa – *əleyhissəlam* – da oldu. ***Ondan Gəlmə Ruhdur*** – isa ruhu idi. Necə ki, Allahın yaratmış olduğu digər məxluqların ruhları kimi. ***«Allah yanında İsa da Adəm kimidir. Allah onu torpaqdan yaratdı. Sonra ona «OL!» dedi. O, da oldu».*** *(Ali İmran 59).*
69 Buxari, Müslim.
70 İbn Hibban 2324, əl-Həkim 1/528 səhih demiş, əz-Zəhəbi də razılaşmışdır.
71 Tirmizi 2639, 2641, İbn Məcə 4300, Əhməd 4/213, əl-Həkim 1/5,6, 213.
72 Müslim 23.

birdir. Bu sayılanların heç birində ortağı (şəriki ) yoxdur. Həmçinin yaratmaqda da, əmr etməkdə də, öldürməkdə də, diriltməkdə də, ruzi verməkdə də, xəstəlik göndərən və şəfa verməkdə də ortağı (şəriki) yoxdur. ***«Həqiqətən Rəbbiniz göyləri və yeri altı gündə xəlq edən, sonra ərşə yüksələn, sürətlə təqib edən, gündüzü gecə ilə örtüb bürüyən, günəşi, ayı və ulduzları əmrinə tabe edərək yaradan Allahdır. Bilin ki, yaratmaq da, əmr etmək də ona məxsusdur. Aləmlərin Rəbbi olan Allah nə qədər uca və böyükdür».*** *(əl-Əraf 54).* ***«Ey insanlar! Allahın sizə olan nemətini yada salın. Allahdan başqa sizə göylərdən və yerdən ruzi verən bir xaliq varmı? Ondan başqa heç bir ilah yoxdur. Elə isə necə döndərilirsiniz?».*** *(Fatir 3).*

***Tövhid*** **–** sözünün mənası bir şeyi bir etmək, birləmək deməkdir. ***Tövhidi Əfkar*** – etməliyik deyildiyi zaman, fikirlərin bir və tək qılınması, hər başdan çıxan ayrı-ayrı səslərin, fikirlərin bir nöqtədə birləşdirilməsi istənmiş olur. Lakin bir şeyi bir və tək qılmaq bu ancaq nəfy və isbatla olur . İbn Mənzur – *rahmatullahi aleyhi* – deyir ki: «Tövhid - Allahın hər baxımdan bir və tək olduğuna, heç bir ortağı olmadığına inanmaqdır. Allah ***Vahid*** və ***Əhəddir***. Vəhdəniyyət və təvahhud sahibidir. «Allah ***Vahiddir***» – demək, «Allah heç bir bənzəri və ortağı olmayan bir Zatdır, tək və birdir» deməkdir . əl Bəycuri – *rahmatullahi aleyhi* – deyir ki: «Lüğət etibarıyla Tövhid kəliməsinin mənası bir şeyin bir və tək olduğunu bilməkdir» . Şeyx AbdurRahman Qasım – *rahmatullahi aleyhi* – deyir ki: «Tövhid kəliməsi ***Vahəddəhu***, ***Yuvəhhiduhu*** tövhidin məsdəri olan bir kəlimədir ki, Onu bir və tək qıldı mənasına gəlir. Həmçinin də Onun bir və tək olduğunu söylədi mənasını alır» . Şeyx AbdulAziz b. Baz – *rahmatullahi aleyhi* – deyir ki: «Tövhid – ***Vahhadə, Yuvahhidu*** **-** nun məsdəridir. Allahın bir və tək olduğunu qəbul etdi, Allahın Uluhiyyət və Rububiyyət, İsim və Sifətlərində bənzərsiz və ortağsız olduğuna, ibadətin yalnız Allaha olacağına iman etdi, kimsə Onu tövhid etməsə belə, Onun zatında və hər baxımdan Bir, Uca və Ulu olduğuna etiqad etdi mənasını verir» . Şeyx Muhəmməd əl-Useymin – *rahmatullahi aleyhi* – deyir ki: «***Tövhid – Vahhadə*** **-** nin məsdəridir. ***Tövhid*** etdi deyildiyi zaman bir şeyin birləndiyi başa düşülür. Ancaq bu isbat və nəfy olmadan olmaz» .

Termin olaraq ***Tövhid*** **–** yalnızca uca və böyük olan Allaha ibadət etmək deməkdir. Yəni ona heç bir şeyi ortaq (şərik) qoşmayaraq nə bir rəsul, nə bir peyğəmbər, nə bir mələk, nə bir cinn, nə bir hakim, nə bir övliya, nə bir seyyid, nə bir daş, ağac, dəmir, nə də yaradılmışlardan hər hansı bir şeyi ona – Allaha ortaq (şərik) qoşmayaraq bir və tək olaraq ona ibadət etmək deməkdir. Sevərək, təzim edərək, mükafatını umaraq, cəzasından qorxaraq yalnızca Allaha qulluq etmək, ibadətə sadəcə onu layiq görməkdir. İsbəhani – *rahmatullahi aleyhi* – deyir ki: «Bəzi alimlərimiz ***Tövhid*** **–** Vahiddən təşbihi rədd etməkdir» deyə açıqlamışlar. Bəziləri də: «***Tövhid*** **–** Birlənən Vahiddən və Onun sifətlərindən təşbihi nəfy etməkdir» demişlər. Bəziləri də: «Mütləq bir və tək olduğuna inanılan Zatın heç bir ortağı və bənzəri olmadığını bilib qəbul etməkdir. Kimsə bunu belə bilməzsə Allahı birləmiş olmaz, Onu tövhid etmiş olmaz»

---

[73] ***Şərik*** **–** bir şeydə hissəsi olan kimsədir.
[74] «Tövhidi Əvvələn» s. 15.
[75] «Lisanul Arab» 3/450 Vəhhadə maddəsi.
[76] «Cəvharətud Tövhid» s. 10
[77] «Haşiyətu Kitabi Tövhid» s. 11.
[78] «Məcmuu Fətava» 1/34.
[79] «Məcmuu Fətava» 2/7.

deyə açıqlamışlar . Şeyxulislam b. Teymiyyə – *rahmatullahi aleyhi* – deyir ki: «***Tövhid*** **-** Allahı bir və bənzəri olmayan bir zat olaraq bilib yalnız və yalnız Ona ibadət etməkdir. Ondan başqa heç bir Rəbb yoxdur inancı da bura daxildir» . Şeyx Muhəmməd b. AbdulVəhhab – *rahmatullahi aleyhi* – deyir ki: «Biləsən ki, ***Tövhid*** **-** Allahı ancaq Ona ibadət etmək (Ona tapınmaq) surətiylə birləməkdir» . Şeyx Muhəmməd b. AbdulVəhhab – *rahmatullahi aleyhi* – deyir ki: «***Tövhid*** **–** Allaha ibadət etmək və Onu, O və Rəsulu necə vəsfləndirmişsə o, cür də vəsfləndirmək. O, və Rəsulu Onu ayıb və nöqsanlardan və yaradılmışlara bənzəməkdən necə uzaq etmişsə eləcə də uzaq etməkdir» . Allama əl-Bəycuri – *rahmatullahi aleyhi* – deyir ki: «***Tövhid*** **–** Məbudun zatı, sifətləri və felləri baxımından bir və tək olduğuna kəsin bir şəkildə inanmaqla birlikdə, yalnız və yalnız Allaha ibadət etməkdir» . İmam AbdulAziz b. Baz – *rahmatullahi aleyhi* – deyir ki: «Allahı ***Tövhid*** etmək Onun bir və tək olduğuna inanıb, qəlbi bu inanca sımsıxı bağlamaq ilə bərabər, ibadətdə də Onu birləmək və tək etməkdir. Yəni tam bir iman və sədaqətlə yalnız Allaha ibadət etmək, saleh əməllər etməkdir. Yoxsa yalnız dil ilə: «Allah birdir» deməklə ***Tövhid*** gerçəkləşməz. Eyni zamanda bu tövhidin ziddi olan hər cür əməli batil edən şirk və şirk yollarından da uzaq olmağı özündə əhatə edir» . Abdullah əl-Ğuneyman – *rahmatullahi aleyhi* – deyir ki: «***Tövhid*** **–** haqq məbudu, Ona olan sevgi, sayğı və təslimiyyətin ən yüksəyini əhatə edən, ən böyügünü ifadə edən «ibadət»-lə ***Tövhid*** etməkdir» .

Burada olan ibadətdən, qulluqdan məqsəd Allahın ***Tövhid*** edilməsidir. Buna görə də ey Allahın qulu! Sənə ilk lazım olan dini vəzifədən, ibadətləri və hətta namaz kimi bir ibadəti belə öyrənməmişdən öncə Tövhidi öyrənmək sorumluğu olduğunu heç vaxt unutma» . Buna görə də qul bütün hüquqi və özəllikləri ilə tövhidi bilmək və tanımaq məcburiyyətindədir. Ağlı başında olan müddətdən ölüncəyə qədər tövhidə möhtacdır. Çünki İslam da ***Tövhid*** hər şeyin təməlidir. ***Tövhid*** olmadıqca Uca Allah qulun heç bir əməl və ibadətini qəbul etməyəcəkdir. Çünki müsəlmanın həyatı Tövhidsiz təsəvvür olunmazdır və ***Tövhid*** dini vaciblərin təməli, ən böyüyü və qüvvətlisidir. Allahın göndərdiyi Nəbi və Rəsullar Tövhidlə başlamışlar. İnsanları ancaq Tövhidə dəvət etmişlər. Bu da Nuh – *əleyhissəlam* - dan, nəbimiz Muhəmməd - *sallallahu aleyhi və səlləm* – ə qədər gələn bütün Peyğəmbərlərin gətirdiyi Tövhiddir. Bu Tövhid də ***Lə İləhə İlləllah*** **-** kəlməsinin mənasını ifadə edir. Bütün Peyğəmbərlərin dəvət etdiyi ***Tövhid*** də elə budur. Yəni Allahdan başqa ibadətə layiq heç bir haqq ilah yoxdur. İbn Teymiyyə – *rahmatullahi aleyhi* – Tövhidin mühümlüyünü bu sözlərlə bəyan etmişdir: «Uca Allah bu tövhidi kitabında açıqca bildirmiş və Ona şərik qoşulmasını rədd etmişdir. O, qədər aydın və kəsinliklə ki, atrıq Qurandakı Tövhidə inanan bir müsəlman, əsla Allahdan başqasından qorxmaz, Ondan başqasından bir şey gözləməz, Ondan başqasından istəməz. Muhəmməd - *səllallahu aleyhi və səlləm* – də: «Ey insanlar! ***Lə İləhə İlləllah!*** deyin ki, qurtuluşa çatasınız». Həqiqətən də bu «***Lə İləhə İlləllah***» tövhididir. Həqiqətən də bu «Allahdan başqa ilah tanımamaq tövhididir».

---

[80] «əl-Huccə Fi Bəyani Məhaccə» 1/306.
[81] «Dəru Təaridu Aqli və Nəql» 1/306.
[82] «Məcmuatur Rəsailin Nəcdiyyə» 4/4, «əd-Durərus Səniyyə» 1/48.
[83] «Usuli Dini İslam» s. 7.
[84] «Cəvharətud Tövhid» s. 10.
[85] «Məcmuu Fətava» 2/20.
[86] «Şərhu Kitabu Tövhid Min Sahihi Buxari» 1/38.
[87] Durerus Səniyyə 1/107.

***İlah*** **–** könüllərin sonsuz bir sevgi, saygı rica və qorxu ilə Allaha yönəldiyi, tapınaraq sığındığı haqq ilah ancaq Allahdır» . Hənəfi məzhəbinin imamlarından İbn Əbil İzz əl-Hənəfi – *rahmatullahi aleyhi* – deyir ki: «Bil ki, Tövhid bütün Peyğəmbərlərin ilk dəvətidir, yolun ilk mənzilidir. Qulu Allaha yaxınlaşdıran ən mühüm amildir. Buna görə də qula ilk fərz olan Allahdan başqa ilah olmadığına şəhadət etməkdir. Tövhid bir kimsənin ilk olaraq İslama girdiyi və onunla son olaraq dünyadan ayrılaraq axirətə köçdüyü bir şeydir. Yolun əvvəlində də, sonunda da qula mütləq şəkildə lazım olandır» . Şeyx AbdulƏziz ən-Nəsir ər-Rəşid – *rahmatullahi aleyhi* – deyir ki: «İstər Peyğəmbr – *sallallahu aleyhi və səlləm* – olsun, istər onun peyğəmbər qardaşları olsun – *Allahın salamı onların üzərinə olsun* – insanlara təbliğ etdikləri şeylərin ən böyüyü və ən ucası: «Allahın birliyinə və heç bir şeyi Ona şərik qoşmadan yalnız Allaha ibadət etmək, Allahı isim, sifət və felləri ilə oxşarsız və bənzərsiz Rəbb olaraq tanımağa dəvətdən ibarət olmuşdur. Bu da bütün Peyğəmbərlərin dəvətinin açarı, İlahi dəvətin təməli və özüdür» . Şeyx Muhəmməd b. AbdulVəhhab – *rahmatullahi aleyhi* – deyir ki: «Allah elçilər göndərib, kitablar nazil etməsi ancaq Tövhidin və Tövhidlə əlaqəli bəyanı və təbliği üçündir: ***«Biz hər ümmətə Allaha ibadət edin, Tağutdan çəkinin deyə Pəyğəmbər göndərmişdik. Onların bir qismini Allah doğru yola yönəltmiş, bir qismi isə haqq yolundan azmalı olmuşdur.*** *(Ey müşrüklər)* ***yer üzündə dolaşıb görün ki,*** *(Peyğəmbərləri)* ***yalançı hesab edənlərin axırı necə oldu».*** *(ən-Nəhl 36).* ***«Mən cinləri və insanları yalnız Mənə ibadət etsinlər deyə yaratdım».*** *(əz-Zariyat 56).* Şeyx Saleh əl-Bəlihi – *rahmatullahi aleyhi* – deyir ki: «Bilindiyi kimi Nəbilərin və Rəsulların sayı haqqında: «Nəbilər **124** mindir, Rəsullar da **313** dür» deyə bir xəbər varid olmuşdur. Bu Nəbi və Rəsulların hamısı Allahı birləməyə, hər baxımdan Onu bir bilib yalnız və yalnız Ona ibadət etməyə çağırmışlar» . Şeyx Muhəmməd əl-Useymin – *rahmatullahi aleyhi* – yə: «Qula ilk fərz olan nədir? deyə sual verildikdə o, deyir ki: «Bütün qullara ilk fərz olan Allahı tövhid etmələri və bu ***Tövhid*** ilə birlikdə Muhəmməd - *sallallahu aleyhi və səlləm* – in Allahın elçisi olduğuna şəhadət etməkdir. Ancaq belə bir tövhid ilə, bu tövhidə şəhadət etmək şərtilə əməl və ibadətlər Allahın dərgahında qəbul edilir» .

Məkkə dövrünün müşrükləri bilirdilər ki, hər bir şeyi yoxdan var edən, ruzi verən, öldürən, dirildən, tədbir edən uca və böyük olan Allahdır. ***«De ki, sizə göylərdən və yerdən ruzi verən kimdir, qulaqlara və gözlərə sahib olan kimdir, ölüdən diri, diridən də ölü çıxaran kimdir, hər işi düzüb qoşan səhmana salan kimdir. Onlar Allahdır deyəcəklər. Bəs onda Allahdan qorxmursunuz? O, sizin həqiqi Rəbbiniz olan Allahdır. Haqdan sonra ancaq azmaq gəlir. Elə isə necə üz döndərir-siniz?».*** *(Yunus 31-32).* ***«De ki, əgər bilirsinizsə bu yer və yer üzərində olanlar kimindir? Onlar mütləq Allahındır. Sən de ki, bəs elə isə düşünmürsüz. De ki, yeddi göyün Rəbbi və böyük əzəmətli ərşin sahibi kimdir? Müşriklər «mütləq Allahındır» deyə cavab verəcəklər. Onda sən de ki, bəs elə isə qorxmursunuz?. De ki, əgər bilirsinizsə hər şeyin hökmü əlində olan, himayə edən, amma özünün himayəyə ehtiyacı olmayan kimdir? Onlar Allahındır deyə cavab verəcəklər. Bəs elə isə nə üçün qaçırsınız?».*** *(əl-Muminun 84-89).*

---

[88] Fətva 1/135.
[89] Şərhu Əqidətul Təhaviyyə 1/21-23.
[90] Tənbihatus Sunniyyə s. 33.
[91] Əqidətul Muslimin 1/248.
[92] Məcmuu Fətava 2/22.

Gördüyünüz kimi, bu şeyləri müşriklər də belə rədd etmirdilər. Lakin onlar ***Lə İləhə İlləllah*** kəlməsinin nə məna ifadə etdiyini başa düşüb: ***«Əcəba o, ilahların hamısını bir ilahmı edir. Bu doğurdan da, çox təəccüblü bir şeydir. Onların əyanları çıxıb gedərək belə dedilər: Gedin öz ilahlarınıza*** *(ibadətdə)* ***möhkəm olun».*** *(Sad 5-6).*

Müşriklər, hətta cahillər də bu sözün həqiqi mənasını bilirdilər. Özünün müsəlman olduğunu irəli sürən, müşriklərin, cahillərin bu kəlməni ondan daha yaxşı başa düşdüklərini bildikdən sonra özünə müsəlman deyən insana heyrət edilir. Hətta bu insan etiqad etmədən sadəcə bu sözü hərflərlə tələffüz etməklə işin bitdiyini zənn edir. ***Lə İləhə İlləllahin*** mənasını müşriklərin və cahillərin ondan daha yaxşı bildiyi kimsədə xeyir yoxdur.

Kimisi də bu kəlmədə məqsəd yalnız Rububiyyət tövhidi olduğunu, yəni Allahdan başqa yaradıcı, ruzi verən olmadığına inanmaq olduğunu zənn edirlər.

Lakin bu belə deyil, Tövhid həm qəlb, həm dil, həm də əməl ilə olması qaçınılmazdır. Əgər bir kimsə Tövhidi bilməklə əməl etməzsə, o kimsə Firon, İblis və s. bənzəri kimi bir kafirdir. Çünkü qəlbin Tövhidinin arxasından söz və əməl ilə Tövhid gəlir. Əgər bir kimsə qəlbi ilə Tövhid edərsə, lakin Allaha söz və əməlləri ilə Tövhid etməyəcək olursa, bu kişi haqqı kəsin olaraq bilməklə batil üzərinə israr və inadkarlıq edən kimsədir. ***«Möcüzələrimizin həqiqiliyinə daxilən əmin olduqları halda, haqsız yerə və təkəbbürlük üzündən onları inkar etdilər. Bir gör fitnə-fəsad törədənlərin axırı necə oldu?».*** *(ən-Nəml 14).* ***Musa da ona: «Sən bunların məhz göylərin və yerin Rəbbi tərəfindən açıq-aşkar möcüzə olaraq endirildiyini, sözsüz ki, bilirsən. Mən isə, ey Firon, səni artıq məhv olmuş zənn edirəm».*** *(əl-İsra 102).*

Onlara görə ilah istər rəsul, cin, övliya, seyyid, ağac, daş, qəbir və s. olsun, şəfa, övlad diləmək, ruzi istəmək və s. məqsədlər üçün yönəldilmiş şeydir.

Bəziləri hətta İnstituta girmək, öz övladlarını evləndirmək üçün və s. boş-boş və faydasız şeylərlə müraciət edirlər. Baxın: Allah bizi Qurani-Kərimdə daima bu kəlməyə tərəf gəlməyimizi, ona sarılmağımızı və bu ayələrdə ağıl, hikmət sahibləri üçün ibrətlər, faydalar olduğunu buyurur: Bu Tövhidin təməl qaydalarındandır. Onun bənzəri heç bir şey yoxdur: ***«Ona bənzər heç bir şey yoxdur».*** *(əş-Şura 11)* deyə etiqad edilir.

O, yaratdıqlarından heç birinə bənzəməz. Yaratdıqlarından da heç biri ona nə zatında, nə felində, nə ismində, nə sifətində, nə də hüququnda bənzəməz. Heç bir şey ona güc çatdırıb onu aciz buraxmaz. O, dilədiyi hər şeyi etməyə qadirdir. ***«Bir şeyi istədiyi zaman Allahın buyurduğu ona ancaq: «OL!» deməkdir. O da dərhal olar».*** *(Yasin 82).*

Heç bir şey ona zor gələ bilməz. Heç bir şey də onu gücündən qoya bilməz. ***«Göylərdə və yerdə Allahı aciz edə biləcək heç bir şey yoxdur».*** *(Fatir 44).*

Bu onun qüdrətinin kamilliyindəndir. Nəyi dilərsə, o, olmuşdur, nəyi də diləməmişsə, o, olmamışdır. Bu da onun Rububiyyətinin kamil-liyindəndir. Ondan başqa ilah yoxdur kəlməsi - ***Tövhid*** budur. Bütün Rəsulların çağırışı da budur. ***«Biz hər ümmətə Allaha ibadət edin, Tağutdan çəkinin deyə Pəyğəmbər göndərmişdik. Onların bir qismini Allah doğru yola yönəltmiş, bir qismi isə haqq yolundan azmalı olmuşdur.*** *(Ey müşrüklər)* ***yer üzündə dolaşıb görün ki,*** *(Peyğəmbərləri)* ***yalançı hesab edənlərin axırı necə oldu».*** *(ən-Nəhl 36).*

Allahdan başqa ibadət olunmağa layiq heç bir haqq ilah yoxdur deməkdir. Çünkü yaradan, ruzi verən, hər şeyə malik də odur. Ondan başqa ibadət edilənlərə isə ancaq və

ancaq batil bir yolla ibadət olunmuş olur. Bu belədir, çünkü Allah haqqın özüdür. ***«Çünki Allah haqq, müşriklərin ondan başqa ibadət etdikləri*** *(bütlər, tanrılar)* ***isə batildir. Həqiqətən Allah uca və böyükdür».*** *(əl-Həcc 62).*

Baxın: Bu qədər kamil, gözəl ad və sifətlərə malik olan Allahı buraxıb, ehtiyacı olan, möhtac, aciz olan hər hansı bir şeydən kömək istəmək olarmı? Fikirləşin.

Tövhid üç növdür: ***1. Rububiyyə.*** **2.** ***Uluhiyyə.*** **3.** ***Isim Və Sifətlər.***

## RUBUBİYYƏT TÖVHİDİ

***Rububiyyə*** – Rəbb sözündəndir. Lüğətdə – ***Mürəbbi*** **-** tərbiyə edici, ***Malik*** **-** mülk və iqtidar sahibi, ***Seyyid*** **-** ağa, ***Mudəbbir*** **-** yönəldən, düzüb qoşan, ***Vəli*** **-** idarəçi, ***Munim*** **-** neymət verici, ***Mutəmmim*** **-** tamamlayan və s. mənaları ifadə edir[93].

***İstilahi Mənası –*** hər bir şeyin Rəbbinin və mütləq Malikinin Allah olduğuna, ortağının olmadığına, tək yaradıcı o olduğuna, bütün kainatı idarə edən, qullarını yaradıb onları ruziləndirən, həyat verən və canlarını alanın o olduğuna kəsin olaraq inanmaq, Allahın qəza və qədərinə, zatında vəhdəniyyətinə, yəni bir və tək olduğuna inanmaq deməkdir. ***«Həmd olsun Allaha - aləmlərin Rəbbinə».*** *(əl-Fatihə 1).* ***«Aləmlərin Rəbbi olan Allah nə qədər uca, nə qədər böyükdür».*** *(əl-Əraf 54).* ***«Hökm əlində olan Allah nə qədər uca, nə qədər uludur. O, hər şeyə qadirdir!».*** *(əl-Mulk 1).* ***«Yer üzündə nə varsa, hamısını sizin üçün yaradan, sonra səmaya üz tutaraq onu yeddi qat göy halında düzəldib nizama salan odur. O, hər şeyi biləndir!»*** *(əl-Bəqərə 29).* ***«Göyləri və yeri xəlq edən, zülmətləri və nuru yaradan Allaha həmd olsun».*** *(əl-Ənam 1).*

Tövhidin bu növünü Məkkə dövrünün müşrükləri də belə qəbul edirdilər. Onlar bilirdilər ki, hər bir şeyi yoxdan var edən, ruzi verən, öldürən, dirildən, tədbir edən uca və böyük olan Allahdır. ***«De ki, sizə göylərdən və yerdən ruzi verən kimdir, qulaqlara və gözlərə sahib olan kimdir, ölüdən diri, diridən də ölü çıxaran kimdir, hər işi düzüb qoşan səhmana salan kimdir. Onlar Allahdır deyəcəklər. Bəs onda Allahdan qorxmursunuz? O, sizin həqiqi Rəbbiniz olan Allahdır. Haqdan sonra ancaq azmaq gəlir. Elə isə necə üz döndərirsiniz?».*** *(Yunus 31-32).* ***«De ki: «Əgər bilirsinizsə bu yer və yer üzərində olanlar kimindir?» Onlar mütləq: «Allahındır» deyə cavab verəcəklər. Sən de ki: «Bəs elə isə düşünmürsünüz». De ki: «Yeddi göyün Rəbbi və böyük əzəmətli ərşin sahibi kimdir?» Müşriklər mütləq: «Allahındır» deyə cavab verəcəklər. Onda sən de ki: «Bəs elə isə qorxmursunuz?». De ki: «Əgər bilirsinizsə hər şeyin hökmü əlində olan, himayə edən, amma özünün himayəyə ehtiyacı olmayan kimdir?» Onlar mütləq: «Allahındır» deyə cavab verəcəklər. Sən de ki: «Bəs elə isə nə üçün qaçırsınız?».*** *(əl-Muminun 84-89).* ***Həqiqətən əgər sən müşriklərdən «Göyləri və yeri kim yaratmışdır?» deyə soruşsan, onlar mütləq «Allah!» deyə cavab verəcəklər. De ki, həmd olsun Allaha!».*** *( Loğman 25).*

Gördüyünüz kimi, bu şeyləri müşriklər də belə rədd etmirdilər. Bunun belə olmasına səbəb qulların qəlbləri fitrətdən yeganə Rəbb olanı qəbul edəcək şəkildə yaradılmış olmalarıdır.

Allahın ruzi verməsi! ***«Mən onlardan ruzi istəmirəm, mən onlardan məni yedirtmələrini də istəmirəm! Şübhəsiz ki, ruzi verən də, yenilməz qüvvət və hikmət sahibi olan Allahdır».*** *(əz-Zariyyat 57-58).* ***«De ki, göylərdən və yerdən sizə ruzi***

---

[93] İbn Mənzur «Lisanul Ərəb» 1/399.

***verən kimdir?*** *(əgər onlar sənə bilmirik deyə cavab versələr)* ***de ki, Allahdır. Elə isə doğru yolda olan, yaxud açıq-aşkar azan bizik, yoxsa siz».*** *(Səba 24).* ***«Sizi yaradan, sonra sizə ruzi verən, sizi öldürən və daha sonra*** *(Qiyamət günü)* ***diriıldən məhz Allahdır. Şərikləriniz içərisində bunlardan heç olmasa birini edən varmı?».*** *(ər-Rum 40).* Əbu AbdurRahmən Abdullah b. Məsud – *radıyallahu anhu* – rəvayət edir ki, doğru sözlü və doğru sözü təsdiq olunan Rəsulullah - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizdən hər birinizin yaradılışı onun anasının qarnında qırx gün nütfə şəklində olaraq bir yerə gətirilir. Sonra bu müddət qədər aləqa şəklində olur. Sonra yenə bu müddət qədər mudğa şəklində olur. Sonra ona bir mələk göndərilir, mələk ona ruh üflədikdən sonra dörd xüsusiyəti yazmaqla əmr olunur. Ruzisini, əcəlini, əməlini, bədbəxt və ya xoşbəxt olacağını» .

Allahın bizi ruziləndirməsinə ağlı dəlilə gəlincə, bizlər yemək yiyərək və içərək yaşaya bilərik. Yiyəcək və içəcəyi də Allah yaratmışdır. ***«Bəs əkdiyiniz toxuma nə deyirsiniz? Onu bitirən sizsiniz, yoxsa biz? Əgər biz istəsəydik, onu bir saman çöpünə döndərər, siz də mat-məətəl qalıb: «Biz ziyana uğramış, bəlkə də məhrum olmuş kimsələrik deyərsiniz? Bəs içdiyiniz suya nə deyirsiniz? Onu buluddan endirən sizsiniz, yoxsa biz? Əgər istəsəydik, onu acı bir su edərdik. Elə isə niyə şükr etmirsiniz?»*** *(əl-Vaqiə 63-70).*

Allahın bizi əbəs yerə yaratmaması! ***«Yoxsa sizi əbəs yerə yaratdığımızı və hüzurumuza qaytarılmayacağınızı güman edirsiniz».*** *(əl-Muminun 115).* ***«Məgər insan elə güman edir ki, başlı-başına buraxılacaq. Məgər o, tökülən bir qətrə nütfə deyildimi? Sonra laxtalanmış qan oldu və Allah onu yaradıb surət verdi. Sonra da ondan bir kişi, biri qadın olmaqla iki cift yaratdı. Elə isə O - Allah ölüləri diriltməyə qadir deyildirmi?»*** *(əl-Qiyamət 36-40).*

O, ölüləri diriltdikdən sonra da dirildicidir, diriltdikdən əvvəl də dirildicidir. Hər şey ona möhtacdır. Hər işin sonu ona dönəcəkdir. O, heç bir şeyə ehtiyacı olmayandır. Allah heç kimsəni yaratmazdan əvvəl də Rububiyyət sifətlərinə sahibdir. Allah yaratdıqlarını onlar öldükdən sonra da onları yoxdan yaratdığı kimi elə də dirildəcəkdir. O, yaratdıqlarını var etdikdən sonra yaradıcı olduğu kimi, onları var etmədən əvvəl də yaradıcı idi. Uluhiyyət, İsim və sifətlərin Tövhidindən fərqli olaraq Adəm oğullarının fitrətdən, qəlbdən qəbul etdiləri Tövhid də elə budur.

## ULUHİYYƏT TÖVHİDİ

Bu da Allah – *subhənəhu və təalə* – yə ibadət ilə olur. Buna həmçinin ibadətdə Tövhid də deyilir. ***Uluhiyyə –*** ilah sözündəndir. Yalnız Allaha ibadət edilməli, boyun əyilməli, mütləq olaraq sadəcə ona itaət olunmalıdır. Kim olursa olsun - rəsul, mələk, cin, övliya, seyyid, daş, ağac və s. ona ibadətdə ortaq (şərik) qoşulmamalıdır. Namaz, oruc, zəkat, həcc, dua, istianə (yardım diləmək) nəzir, qurban, təvəkkül, ümid, qorxu, sevgi və s. zahiri və batini ibadətlərdən heç biri ondan başqasına edilməməlidir . Allaha həm qorxu, həm ümid, həm də sevgi ilə ibadət olunmalıdır. ***«Biz yalnız sənə ibadət edirik və yalnız səndən kömək diləyirik».*** *(əl-Fatihə 4).* ***«Kim Allah ilə yanaşı***

---

[94] ***Nütfə –*** məni mənasındadır. Nütfə bəzən də saf su adlanır.
[95] ***Aləqa –*** laxtalanmış qan, ziyil deməkdir. ***«O, insanı laxtalanmış qandan yaratdı».*** *(əl-Ələq 2).*
[96] ***Mudğa*** - çeynənilmiş ət parçasına oxşadığı üçün bu ad verilmişdir.
[97] Buxari, Müslim.
[98] İbn Mənzur «Lisanul Ərəb» 1/399.

***başqa bir tanrıya ibadət edərsə, bunun üçün isə onun heç bir əsası yoxdur».*** *(əl-Muminun 117).* ***«Rəbbi yalnız ona ibadət etməyi buyurmuşdu».*** *(əl-İsra 23).* ***«Allaha ibadət edin və ona heç bir şeyi şərik qoşmayın».*** *(ən-Nisa 36).*

Bu Tövhidin gerçəkləşməsi üçün iki ünsur vardır.

**1.** İbadətləri qullardan hər hansı birinə deyil, yalnız Allaha xas qılmalı, Allaha məxsus olan isim və sifətləri qullara məxsus etməməlidir. Mömin yalnız Allaha ibadət edər. Allahdan başqası üçün əsla namaz qılmaz, səcdə etməz, yalvarıb-yaxarmaz. Allahdan başqasına and içməz, nəzir verməz və Allahdan başqasına təvəkkül etməz.

**2.** İbadətin, Allahın əmrlərinə itaətə sövq etməsi, qadağalarından çəkinməsi və Nəbisi – *sallallahu aleyhi və səlləm* – in Sünnətinə uyğun olması gərəkdir. Tövhidi-Uluhiyyətin ən vacib ünsuru, insanın tam mənada Kitab və Sünnətə təslim olmasıdır.

Allaha ibadət, itaət və əmrlərinə boyun əyməklə olur. Buna görə də Rəbb kimdirsə məbud da odur. Məbud isə ibadət olunmağa layiq olan kimsə deməkdir və ya ibadətə layiq olduğu üçün ona ibadət olunan deməkdir. Burada məqsəd ibadət olunan hər kəs Rəbbdir demək deyil. Allahdan başqa ibadət olunan ilahlar ilə o, ilahlara ibadət edənlərin, Allahdan başqa Rəbb etdikləri varlıqlar əslində Rəbb deyil, çünkü Rəbb yaradan, hər şeyə mütləq məxsus olan və bütün işləri idarə edib, düzüb qoşandır. ***«O, göylərin və yerin, onların arasında olan hər şeyin Rəbbidir! Yalnız ona ibadət et və onun ibadətinə səbrli ol! Heç ona bənzərini görürsənmi?»*** *(Məryəm 65).*

Allahdan qeyri ibadət olunanlar heç bir xeyrin gəlməsinə və ya bəlanın uzaqlaşdırılmasına belə maneçilik törədə bilməzlər. ***«De ki: «Elə isə bir söyləyin görək, əgər Allah mənə bir zərər toxundurmaq istəsə, sizin Allahdan qeyri ibadət etdikləriniz onun zərərini aradan qaldıra bilərlərmi?» Yaxud: «Əgər Allah mənə bir mərhəmət əta etmək istəsə, onlar onun mərhəmətinə mane ola bilərlərmi?» De ki: «Mənə təkcə Allah kifayət edər».*** *(əz-Zumər 38).* ***«Əgər Allah sənə bir zərər yetirsə, səni ondan Allahdan başqa heç kəs qurtara bilməz. Əgər Allah sənə bir xeyir diləsə, heç kəs onun nemətinə maneçilik edə bilməz».*** *(Yunus 107).*

Onların ilah etdikləri bu varlılıqlar Uluhiyytdən heç bir xüsusiyyətə malik deyillər. Çünki onlar yaradılmış varlıqlardır. Özləri bir şey yaratmamışlar, onlara ibadət edənlərə zərrə qədər fayda verə və onlara gələn bəlanı aradan qaldıra bilməzlər. Həmçinin onlara həyat verməzlər, öldürməzlər. ***«Müşriklər isə onu qoyub heç bir şey yarada bilməyən, əksində özləri yaradılan, özlərinə nə bir xeyir, nə də bir zərər verə bilən, diriltməyə, öldürməyə və yenidən diriltməyə gücləri çatmayan bütləri özlərinə ilah qəbul etdilər».*** *(əl-Furqan 3).*

Uluhiyyət Tövhidi bütün Peyğəmbərlərin çağırdığı Tövhiddir. Əvvəlki ümmətlərin məhv olmasına səbəb də elə bu Tövhidin inkarı olmuşdur. Baxın, Allah Nuh – *əleyhissəlam* - ın qövmi haqqında belə buyurur: ***Və*** *(öz tabeçiliyində olanlara)* ***dedilər: «Öz tanrılarınızı tərk etməyin,*** *(xüsusi ilə)* ***Vəddi, Suvaı, Yəğusu, Yəuqu və Nəsri atmayın».*** *(Nuh 23).* İbn Abbas – *radıyallahu anhu* - rəvayət edir ki, bunlar Nuh - *əleyhissəlam* - ın qövmünün əməlisaleh insanları idilər. Onlar öldükdən sonra şeytan onların yaşadığı qövmün insanlarına vəsvəsə edir ki, onların qəbirləri üstündə onların heykəllərini ucaltsınlar və onların adlarını həmən heykəllərə versinlər. Uzun müddət keçdikdən və elm yaddan çıxdıqdan sonra o, heykəllərə ibadət etməyə başladılar .

Həqiqətən də bu belədir. Bu hadisələri biz indiki günümüzdə də görə bilərik. Nə qədər əməlisaleh insanlar var ki, öldükdən sonra onların qəbirləri üstündə pirlər,

---

[99] Buxari.

məsçidlər, ibadətgahlar tikilir. Uzun zaman keçdikdən sonra insanların o, qəbirlərin üstünə gəlib onlardan kömək dilədiklərini görürük. Lakin insan bir şeyi unutmamalıdır ki, sıxıntı, kədər, bəla gələndə insan o ibadət etdiklərini unudaraq, əllərini göyə açıb Allaha dua edir. ***«İnsana bir sıxıntı üz verən zaman - uzananda da, oturanda da, ayaq üstə də bizə dua edər. Lakin onu sıxıntıdan qurtardıqda ondan ötrü bizə heç dua etməmiş çıxıb gedər».*** *(Yunus 12).* ***«De ki: «Mənə deyə bilərsinizmi? Sizə Allahın əzabı gəlsə və ya qiyamət başınızın üstünü alsa Allahdan başqasına dua edib yalvaracaqsınız? Əgər doğru danışan adamlarsınızsa*** *(deyin görək)*. ***Xeyr, yalnız Allaha dua edib yalvaracaqsınız. O, əgər istəsə yalvardığınız bəlanı aradan qaldırar. Siz də Ona şərik qoşduğunuz bütləri unudarsınız».*** *(əl-Ənam 40.41).*

Bəli, Allah bu bəlaları uzaqlaşdırdıqdan, sovuşdurduqdan sonra onlar yenə də Allahı unudub ona şərik qoşarlar. ***«Müşriklər gəmiyə mindikləri zaman ancaq Allaha dua edərlər. Sağ-salamat quruya çıxdıqları zaman yenə də*** *(Allaha)* ***şərik qoşarlar».*** *(əl-Ənkəbut 65).* ***«Sizi suda və quruda gəzdirən Odur. Siz gəmidə olduğunuz, gəmilər gözəl bir külək vasitəsilə içərisində olanları apardığı, onlar da sevindikləri vaxt birdən fırtına qopub dalğalar hər tərəfdən gəmilərin üzərinə hücum etdikdə və müsafirlər dalğaların onları bürüdüyünə*** *(həlak edəcəyini)* ***başa düşdükdə sidqi-ürəkdən Allahın dininə sarılaraq Ona belə dua edərlər: «Əgər bizi bu təhlükədən qurtarsan Sənə şükr edənlərdən olarıq. Onları xilas edincə yer üzündə haqsız yerə zülm etməyə, azğınlığa başladılar. Ey insanlar! Etdiyiniz zülm, haqsızlıq fani dünya malı kimi öz əleyhinizədir. Sonra hüzurumuza qaytarılacaqsınız. Biz də nə etdiklərinizi sizə xəbər verəcəyik».*** *(Yunus 22-23).*

Özünü müsəlman sayan hər bir kəs Allahın təkliyini qəbul edib, ondan qeyrisinə ibadət etməklə Allahın əzabından canını qurtaracağını zənn etməsin. Çünki İslam dininin başı, sonu, içi və çölü də Uluhiyyət Tövhididir. Peyğəmbərlərin ilk və son çağırışı da budur. Bunun üçün Pəyğəmbərlər göndərilmiş, kitablar endirilmiş, cihad məqsədi ilə qılınclar çəkilmiş, möminlər ilə kafirlər, Cənnət ilə Cəhənnəm əhli bir-birindən ayrılmışdır. «Allahdan başqa ibadətə layiq heç bir haqq ilah yoxdur» kəlməsinin mənası da elə budur. ***«Səndən əvvəl elə bir Peyğəmbər göndərmədik ki, ona Allahdan başqa heç bir ilah yoxdur. Buna görə də yalnız mənə ibadət edin!» deyə vəhy etməyək».*** *(əl-Ənbiya 25).* ***«Mən cinləri və insanlaı yalnız mənə ibadət etmək üçün yaratdım».*** *(əz-Zariyat 56).*

O, dövr ilə indiki dövr, Allahdan qeyrisinə ibadət edənlər bir və tək ilaha ibadət etmirdilər. Onlar birdən çox ilaha ibadət edib, bununla Allaha yaxınlaşdıqlarını irəli sürürdülər. O, dövr ilə indiki dövr, Allahdan qeyrisinə ibadət edənlərin sözləri də eynidir. Biz Allahı qəbul edirik, sadəcə biz bu salehlərlə Allaha yaxınlaşmağa yol axtarırıq. Allah Qurani Kərimdə Allaha belə bir yolla yaxınlaşmağı axtaranlar barəsində buyurur: ***Allahı qoyub özlərinə dost tutanlar: «Biz onlara bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!» Deyirlər.*** *(əz-Zumər 3).* ***«Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilən bütlərə ibadət edir və: «Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!» deyirlər. De ki: «Allaha göylərdə və yerdə bilmədiyi bir şeyimi xəbər verirsiniz? Allah özünə şərik qoşulan bütlərdən uzaqdır və ucadır».*** *(Yunus 18).*

O, halda ibadət Allaha edilərsə səhih olar. Allah Rububiyyəti qəbul edən müşriklərə bu Tövhidin fayda vermədiyini, əksinə Allah Qurani Kərimdə onları mömin yox kafir olaraq adlandırmışdı. Əgər bir kimsə Rububiyyəti, İsim və Sifətlərin Tövhidini qəbul

edib, lakin bununla bərabər qəbrə gedib o, qəbir sahibinə ibadət etsə və ya ona yaxınlaşmaq məqsədi ilə bir qurban kəssə, belə bir kimsə müşrik və kafirdir. Əbədi Cəhənnəmlikdir.

Həmçinin Rəsulullah – *sallallahu aleyhi və səlləm* - də onlara qarşı qılınc qaldırmış, onların canlarını və mallarını halal qılmışdı. ***De ki: «Şübhəsiz Rəbbim məni doğru yola, həqiqi dinə, batildən haqqa tapınan və müşriklərdən olmayan İbrahimin dininə yönəltdi!» De ki: «Mənim namazım da, ibadətim də, həyatım və ölümüm də aləmlərin Rəbbi Allah üçündür».*** *(əl-Ənam 161-162).*

Möhtərəm oxucularımız! Allaha ibadət edin, ona heç bir şeyi ortaq (şərik) qoşmayın, öz əməllərinizi, işlərinizi puça çıxartmayın. Allah öz qullarına ona ibadət, itaət etməyi əmr edir. Ona itaət etdiklərinə görə, bundan ötrü onlara bol qarşılıq verəcəyini vəd etmişdi. Ona üsyan edilməsini qadağan etmiş, bundan ötrü onları cəzalandıracağını xəbər vermişdi. ***«Bunlar Allahın sərhədləridir.*** *(hökümləridir)* ***Hər kəs Allaha və Peyğəmbərinə itaət edərsə, Allah onu ağacları altından çaylar axan Cənnətlərə əbədi olaraq daxil edər ki, bu da böyük uğur və qurtuluşdur. Hər kəs Allaha və Peyğəmbərinə itaət etməyib onun sərhədlərini aşarsa, Allah da onu həmişəlik Cəhənnəmə daxil edər. Onu rüsvayedici əzab gözləyir».*** *(ən-Nisa 13-14).*

## TÖVHİDİN FYDALARI

Peyğəmbr – *sallallahu aleyhi və səlləm* – dən tutmuş Səhabələr, Tabiinlər, onların yollarını qarış-qarış, addım-addım izləyənlər Tövhidin həqiqiliyini başa düşərək onu bütün həyatlarında tətbiq etmişlər. Bu tövhidin insanın həyatına, nəfsinə çox böyük təsiri vardır. Həmçinin də bütün bəşəriyyətə böyük təsiri vardır. Tövhid dedikdə Sələf minhəci[100] üzərində qurulan tövhid nəzərdə tutulur. Bu da böyük əsaslar üzərində qurulmuşdur. Rububiyyət, Uluhiyyət və İsim və Sifətlərin tövhididir. Çünki bizlər bu dünyada Allaha iman gətirmişik. Allah – *subhənəhu və təalə* – qeybdir. Allah ən böyük qeybdir. Çünki bizlər Allahı bu dünyada görməmişik və bu dünyada da görməyəcəyik. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Biliniz ki, sizdən heç kimsə ölümündən öncə öz Rəbbini görməyəcəkdir»[101]. Allahı görmək yalnız Qiyamət günü Cənnət əhli üçün olacaqdır. Lakin bizlər Allahı onun İsim və Sifətləri ilə bilib tanıyırıq. Bilirik ki, Allah göyə yüksəlib, göydədir, ərşə yüksəlib və s. O, bizim etdiyimiz hər bir əməli görür və o, bizə yaxındır. Allahın bizə məlum olan **99** gözəl İsimləri və Uca Sifətləri vardır. Həmçinin də bu Tövhid Uluhiyyət tövhidi üzərində qurulub. Bütün Peyğəmbərlər Uluhiyyət tövhidi üçün gəlmişlər. ***Lə İləhə İlləllah*** – Tövhid kəliməsi. Bu bütün işin əsasıdır. Allah göyləri və yerləri buna görə yaratmışdır. Kafirlərə qarşı döyüşləri də elə buna görə vacib etmişdir. Peyğəmbərlər buna görə göndərilmişdir. Kitablar buna görə nazil olmuş və hər bir Peyğəmbər də öz qövmünə gələrək deyərdi ki: «Sizlər Allaha ibadət edin, sizin ondan başqa İlahınız yoxdur. Ey qövmüm! ***Lə İləhə İlləllah*** – deyin. Bu o, kəlimədir ki, göylərdən də, yerlərdən də ağır gəlmişdir. Hər bir qul (bəndə) qəlbi ilə, əməlləri ilə və bütün işlərində Allaha yönəlməlidir. Sevilməyə, umulmağa, qorxulmağa layiq yalnız Allahdır. Dua edilməyə, çağrılmağa, təvəkkül edilməyə, qurban kəsilməyə və onun üçün nəzir deyilməyə layiq olan

[100] ***Minhəc*** – metod, yol, Sələfi Salihin yolu.
[101] Buxari, Müslim.

Allahdır. Tək ondan şiddət zamanı yardım istənilir, istiazə[102] yalnız ona edilir. Tövhid də elə budur. Tövhid hər bir bəndənin imanını nizama qoyur və ona tək olan ***Qahhar*** olan Allaha bağlayır. Ona inanır, Onu təsdiq edir və qəlbi ilə Ona yönəlir. Bu elə bir tövhiddir ki, qəlbdən gəlir. Onun bütün əməlləri, əzaları ibadət əməl və itaət tərəfdən Allaha yönəlir. İbadət özü zəlillik və tək olan Allaha itaətkarlıqdır. Bu da tək olan Allaha, şəriki olmayan Allaha itaətlə olur. Allaha itaət Onun şəriətini, qoyduğu qanunları yerinə yetirməklə, yalnız Ona ibadət etmək və həyatın hər bir anında Onun tələb etdiyi şəkildə əməl etməklə olur. Bununla da tövhid əhlinin ***Muvahhidin*** həyatı əvvəlindən axıradək ibadətlə keçir. Bütün bunların hamısı da bu tövhiddən irəli gəlir. ***Lə İləhə İlləllah*** kəliməsi üzərində qurulub. Bu tövhid ilk an çıxanda qəlbdən doğur. Mömininin qəlbində bu tövhid möhkəm yerləşir. Sonra imana çevrilir. Sonra da qəlbi əməllərə, sonra da zahiri əməllərə çevrilir (yəni insanın zahirində büruzə verir). Bu ibadət özü də üç əsas üzərində qurulur.

**1.** *Tək Olan Allahı Sevmək.* **2.** *Tək Olan Allahdan Qorxmaq.* **3.** *Tək Olan Allahı Ummaq.*

Bu da Sevgi, Qorxu və Ümüddür. İslam alimləri bu əsasları bir quşa bənzətmişlər ki, Sevgi quşun baş hissəsi, qorxu sağ qanadı, ümüd isə quşun sol qanadıdır. Quş bunlardan birini itirərsə uça bilmədiyi kimi həmçinin də Allaha seyr edən insan, Allaha yönələn insan da bunlar olmasa Allaha seyrini davam etdirə bilməz. Görürsən ki, insan yalnız Allaha ibadət edir, Ona itaət edir, ondan qorxur və bütün işlərində Onu umur. Allahdan Allaha sığınır, Allahın qəzəbindən rizasına, Allahın cəzasından isə Allaha sığınır. Tövbəsini elan edərək, bütün itaətləri bəyan edərək Allah qarşısında qul olduğunu bildirərək. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allahın qəzəbindən rizasına sığınıram. Cəzalarından isə ehsan edəcəyi afiyətinə sığınıram. Səndən Sənə sığınıram»[103]. Tövhidin əsası imandır. Buna görə də insanlar bu tövhiddə fərqlənirlər. İmanlarına, təsdiqlərinə və əməllərinə görə. Tövhid əhli də öz aralarında fərqlidirlər.

Bu Tövhidin təsiri həm fərdi, həmçinin də cəmaatı, ümməti əhatə edir. Bütün aləmi, insanların daxili və xarici ehtiyaclarını əhatə edir. Sonra da dünya və axirəti də əhatə edir. Allah bu Tövhidin həqiqətini qəlbdə əkilməsini gözəl ağaca bənzədir. ***«Məgər Allahın necə məsəl çəkdiyini görmürsənmi? Xoş bir söz*** *(Lə İləhə İlləllah, Muhəmmədən Rəsulullah)* ***kökü yerdə möhkəm olub budaqları səmaya ucalan gözəl bir ağac (xurma ağacı) kimidir. O, ağac Rəbbinin izni ilə hər vaxt bəhrəsini verir. Allah insanlar üçün belə məsəllər çəkir ki, bəlkə bəlkə düşünüb ibrət alsınlar!*** *(Ağacı kökü yerdə, budaqları göydə olduğu kimi mömininin də imanı qəlbində sabit qalır, əməlləri isə göyə – Allahın dərgahına yüksəlib ona daim savab qazandırır).* ***Pis söz isə yerdən qopardılmış, kökü olmayan pis bir ağaca bənzəyir».*** *(İbrahim 24).* İman və Tövhid. O, tövhid ki, ***Lə İləhə İlləllah*** kəliməsi üzərində qurulub. Bu kəlimə əsası yerdə möhkəm olan budaqları göyə yüksələn gözəl ağaca bənzəyir. Bu gözəl kəlimə də ***Lə İləhə İlləllah*** kəliməsidir. Bunun da ən böyük səmərəsi saleh əməldir. Gözəl ağac səmərə, bəhrə verdiyi kimi ***Lə İləhə İlləllah*** ağacının səmərəsi də saleh əməldir. Bu kəlimənin əsası möhkəmdir. Bu kəlimə sadəcə dillə deyilən bir kəlimə deyildir. Bu kəlimənin rukunları, şərtləri və dayaqları vardır. Bu kəlimə əsaslı bir

---

[102] ***İstiazə*** – xoşlanılmayan bir şeydə himayə edilməyi istəmək deməkdir. ***«De ki: Pənah aparıram sübhün Rəbbinə».*** *(əl-Fələq 1).* ***«De ki: Pənah aparıram insanların Rəbbinə».*** *(ən-Nəs 1).*

[103] Müslim 486, İmam Əhməd «Musnəd» 6/201, İbn Məcə 3841, Əbu Davud 879.

kəlimədir. Ağacın kökləri yerdə möhkəm olduğu kimi iman ağacı da mömінin qəlbində möhkəm yer tutmuşdur. Bu ağac göyə yüksəlir, ***Lə İləhə İlləllah*** kəliməsinin sahibi bununla izzətlənir, izzət duyur. Həmçinin bu kəlimənin bu ağaca bənzədilməsi bizə iki mühüm şeyi bəyan edir.

1. Bu əkilmiş ağacdır. Bu ağacı vaxtlı-vaxtında suvarmaq, belləmək və qulluq etmək lazımdır. Həmçinin ***Lə İlahə İlləllah*** kəliməsini də vaxtlı-vaxtında suvarmaq lazımdır. Bu kəlimənin suvarılması isə elm, saleh əməl və Allaha yaxınlaşmaqla olur. Bu kəlimənin daima mömin tərəfindən qorunmağa, xidmət edilməyə ehtiyacı vardır.

2. Bu ağac əkildikdən, xidmət edildikdən sonra bu ağacın ətrafında ağaca ziyan vuran alaq otlardan təmizləmək lazımdır. Həmçinin də mömінin qəlbində olan o, ***Lə İləhə İlləllah*** ağacının ətrafında da qəribə bitkilər bitir. Şirk, riya, küfr, bidət və s. Buna görə də mömin qəlbində olan bu ağacla daima maraqlanmalıdır. Hətta qəlbində olan ***Lə İləhə İlləllah*** ağacı salamat qalsın. Tövhidi salamat qalsın. Hətta ona etiqad edənlərdən, ona inananlardan və ona heç bir şeyi şərik qoşmayanlardan olsun.

# TÖVHİDİN ALƏMLƏRƏ TƏSİRİ

***Tövhidin Təsiri Üç Qismə Bölünür***:

**1.** *Tövhidin Fərdlərə, Şəxslərə Olan Təsiri.* **2.** *Tövhidin Cəmiyyətə, Ümmətə Olan Təsiri.* **3.** *Tövhidin Axirətdə Olan Təsiri.*

***Tövhidin Fərdlərə Olan Təsiri*** – Ən böyük təsiri qəlb rahatlığı, nəfsin salamatçılığıdır. Ruhun qidasıdır. İbn Qeyyim – *rahmatullahi aleyhi* – deyir ki, insanın həqiqəti, mahiyyəti onun qəlbi və ruhudur. Bunların da salamat olması, düzgün olması yalnız Rəbbinin tövhidi ilə və Ona olan ibadəti ilə Ondan qorxması və Rəbbini bütün işlərdə umması ilədir. İnsanın ən böyük ləzzəti, ən böyük səadəti və neməti də elə bundadır. Kainatda elə bir şey yoxdur ki, insanın qəlbi onunla rahatlıq tapsın Allahdan başqa. Allaha iman gətirmək, Onu sevmək, Ona ibadət etmək, Allahı ucaltmaq, Onu zikr etmək bu kimi şeylər insanın qidasıdır, onun gücüdür. Bunların da hər birinə Quran, Sünnə və fitrət dəlalət etmiş və şahidlik göstərmişdir.

Amr b. əl-Ass – *radıyallahu anhu* - rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Sizin qəlbinizdə olan iman köhnəlir necə ki, paltar köhnəldiyi kimi. Buna görə də Allahdan o, qəlbinizdə olan imanın təzələnməsini istəyin»[104]. İmanın zəifləməsi insanda qəlb sıxıntısı yaradır. İnsan necə bu qəlb sıxıntısından qurtara bilər. Yalnız Allaha bağlanmaqla. İbn Abbas – *radıyallahu anhu* - rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Allahı Rəbb olaraq, İslamı da din olaraq və Muhəmmədi Rəsul olaraq qəbul edən kimsə imanın şirinliyini, tamını tapar»[105].

İmanın tamını, şirinliyini, dünyanın ləzzətləri və şəhvəti ilə tapmaq olarmı. Əlbəttə ki, yox! İnsan imanın ləzzətini yalnız bununla tapa bilər. Qeyrisi ilə yox. Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Üç şey var ki, sizlərdən kimdə olarsa o, imanın şirinliyini tapar. Allah və Rəsulunu hər şeydən çox sevmək, Allah rizası üçün bir-birinizi sevmək (sevdiyini ylnız Allah üçün sevən), Allahın küfrdən xilas etdiyi və sonra küfrə qayıtmaqdan oda atılmış kimi

---

[104] əl-Albani «Həsən».
[105] Müslim 34.

qorxan (şəxs)» . Bütün bu işlərin üçü də sevgi və məhəbbətlə bağlıdır. Bu yalnız tövhid kəliməsini həqiqi surətdə həyata keçirməklə əmələ gəlir.

Sələflər görərdilər ki, dünya öz əhli içərisində, şəhvətləri içərisində dalğalanır. Kimisi öz vəzifəsinə, kimisi də öz şəhvətlərinə qapanıb. Kimisi şərəf, şan-şöhrət axtarır. Hamı nə isə axtarır. Lakin möminin qəlbi, nəfsi tək olan Allah ilə bağlıdır. Allaha bağlanır və buna görə də qəlb rahatlığı tapır. Fudeyl b. İyad – *rahmatullahi aleyhi* – deyir ki: «Günəş batdıqda mən bu zülmət, qaranlıqla sevinirəm. Rəbbimlə tək qaldığıma görə. Günəş doğduqda isə mən kədərlənirəm. İnsanların mənim yanıma daxil olduqlarına görə. Çünkü onlar bu ləzzəti təklikdə tapırlar. Ləzzəti insanlarla yox, Allah ilə danışmaqda, tək qalmaqda tapırlar». Sələflər deyərdilər: «Gecə əhli, gecəni ibadətdə keçirənlər, gecəni əyləncədə keçirənlərdən onların keçirdikləri daha ləzzətlidir. Əgər gecə olmasaydı biz bu dünyada qalmaq istəməzdik». Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sübh namazının iki rükət (sünnəti) dünya və onun içindəkilərdən xeyirlidir. Həqiqətən mən onları bu dünyadan da çox sevirəm» . Gecənin ortasında Allah üçün etdiyin bu ibadət sənin qəlbində iman əkir, ləzzəti, səadəti əkir. Bu elə bir ləzzət və səadətdir ki, başqa miliyonlarla əldə olunmaz. Nə mülk, nə şərəf bu sevinci əldə edə bilməz. Tövhid insanı Allahdan başqasına qulluqdan xilas edir. Həqiqi qulluq da elə budur. Həqiqi qulluq insanın Allaha qul olmasıdır.

Görürsən ki, bəzi insanlar Allahdan qeyrisinə bağlanırlar. Allahdan qeyrisinə qəlbən bağlandıqlarına görə o, bağlandıqları şeyin qulu olurlar. Nəyə görə? Çünki o, insanın qəlbi yoxdur. Hər gün onun bir İlahı vardır. Allahı buraxaraq o, ilahlara ibadət edir. Bu gün bir pirə, səhəri isə başqa pirlərə gedirlər. Bəziləri qəbirlərə, övliyalara, seyyidlərə, ağaclara, daşlara bəziləri də fal oxlarına, bürclərə (inanaraq) bağlanırlar. Onların qəlbləri Allahdan qeyrisinə bağlandıqlarına görə onun qulu olurlar. Çünkü bağlandığı şeyi bütün işlərində və ehtiyaclarında umur. Ondan qorxduqlarına görə onun qulu olurlar. ***«Nəfsini özünə tanrı edən və Allahın bilərəkdən yoldan çıxartdığı, qulağına və qəlbini möhürlədiyi, gözünə də pərdə çəkdiyi kimsəni gördünmü? Allahdan başqa kim onu doğru yola sala bilər. Məgər düşünüb ibrət almırsınız».*** *(əl-Casiyə 23).* Qəlbləri Allahdan qeyrisinə bağlandığına görə, Tövhidi həqiqi surətdə həyata keçirmədiklərinə görə onlarda qorxu yaranır. Baxırsan insanların halına ki, zəiflədikdə nə günə düşürlər. Allahdan qeyrilərindən qorxurlar. Kahinlərdən, falçılardan, kiminsə cəddindən və s. Gecə və gündüz onu dərd basır. Həqiqi mömin isə heç kəsdən qorxmur. Çünki o, bilir ki, zərər və mənfəət, xəstəlik və şəfa yalnız Allahın əlindədir. ***De ki: «Elə isə bir söyləyin görək, əgər Allah mənə bir zərər toxundurmaq istəsə, sizin Allahdan qeyri ibadət etdikləriniz onun zərərini aradan qaldıra bilərlərmi?» Yaxud: «Əgər Allah mənə bir mərhəmət əta etmək istəsə, onlar onun mərhəmətinə mane ola bilərlərmi?» De ki: «Mənə təkcə Allah kifayət edər».*** *(əz-Zumər 38).* ***«Əgər Allah sənə bir zərər yetirsə, səni ondan Allahdan başqa heç kəs qurtara bilməz. Əgər Allah sənə bir xeyir diləsə, heç kəs onun nemətinə maneçilik edə bilməz».*** *(Yunus 107).* ***«De ki: «Bir deyin görək əgər Allah sizin qulaqlarnızı və gözlərinizi əllərinizdən alsa, ürəklərinizə də möhür vursa onları sizə Allahdan başqa kim qaytara bilər. Gör biz onlara ayələrimizi necə izah edirik ki, onlar da necə üz döndərirlər».*** *(əl-Ənam 46).* Qul hər şeyin Allahdan gəldiyini bildiyinə görə yalnız

[106] Buxari, Müslim.
[107] Müslim.

Allah hüzurunda qorxu və sayğı duymalı və yalnız Ona qarşı təqvalı davranmalıdır. ***«O, halda insanlardan qorxmayın Məndən qorxun».*** *(əl-Maidə 44).* ***«…Və yalnız Məndən qorxun».*** *(əl-Bəqərə 40).* ***«Allaha və onun Peyğəmbərinə itaət edənlər, Allahdan qorxub çəkinənlər məhz belələri uğura çatanlardır».*** *(ən-Nur 52).* ***«…Qorxub çəkinməyə də,*** *(günahları)* ***bağışlamağa da layiq olan ancaq Odur».*** *(əl-Muddəssir 56).* ***«Sizi yalnız o, şeytan öz dostlarından olması ilə qorxudub çəkindirir. Amma siz onlardan qorxmayın. Əgər möminsinizsə Məndən qorxun».*** *(Ali-İmran 175).*

Hər bir məxluqun bir yaradılmışdan, ya da yaradıcıdan qoxmasının qaçınılmaz olduğu məlumdur. Yaradılmışdan qorxmanın zərəri bir çox baxımdan faydalarından daha ağırdır. Allahdan qorxmaq isə dünya və axirət səadətinin səbəbidir. Həqiqətən Allah ondan qorxulmaya daha layiqdir. Əbul-Abbas Abdullah b. Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, bir gün (minikdə) Peyğəmbər – *sallallahu aleyhi və sələm* – in arxasında oturmuşdum. O, buyurdu: «Ey oğul! Mən sənə bir neçə kəlimə öyrədəcəm. Allahı qoru ki, Allah da səni qorusun. Allahı qoru ki, onu öz qarşında tapasan. Bir şey dilədikdə, Allahdan dilə. Kömək istədikdə yenə də Allahdan kömək istə. Bunu da bil ki, əğər bütün insanlar sənə xeyir vermək üçün bir yerə yığışsalar da belə Allahın yazdığından artıq sənə heç bir xeyir verə bilməzlər. Bunu da bil ki, əğər sənə zərər vermək üçün bir yerə yığışsalar da yenə də Allahın yazdığından artıq sənə zərər verə bilməzlər. (Çünkü) qələmlər qaldırılmış, səhifələrin (mürəkkəbi) qurumuşdur» . İnsanlar Tövhiddən uzaqlaşdıqlarına görə, tövhidi həqiqi surətdə həyata keçirmədik-lərinə görə, Allahdan qeyrilərinə bağlandıq-larına görə insanlardan qorxurlar. Həqiqi müsəlmanlar isə şiddət anında da, çətinləklərdə də Allaha yönələrlər.

Bəziləri isə dünya və onun şəhvətlərinə bağlanırlar. Onun arxasınca gecə və gündüz gedirlər. Onlar dünyanın şəhvəti üçün sevinir və onun üçün ağlayırlar. Bəzən də buna görə gecələri də yatmırlar. Dünyada bir şey əldə etdikdə sevinir, əldə etmədikdə isə kədərlənirlər. ***«Kim*** *(axirətdən vaz keçib)* ***dünya və onun bər-bəzəyini istəyirsə, biz onun əməllərinin əvəzini*** *(sağlamlıq, sərvət, övlad, gözəl yaşayışı)* ***elə dünyada ikən verərik. Onların dünyadakı mükafatları əsla azaldılmaz. Belələrinin axirətdə atəşdən başqa heç bir payı yoxdur. Onların dünyada gördükləri işlər puç olar və bütün əməlləri boşa çıxar».*** *(Hud 15-16).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dinarın qulu bədbəxt olsun, dirhəmin qulu bədbəxt olsun. Pal-paltarın, zinətin qulu bədbəxt olsun. Beləsinə istədiyi veriləndə razı qalar, verilməyəndə isə qəzəblənər. Bədbəxt olsun və başı aşağı çevrilsin. Onun ayağına batan tikan belə çıxmasın» . İnsanın malı dünyanı sevməsi və bu işdə dəridən qabıqdan çıxması insanın bu şərəfli ömrünü zay etməsidir. Onlar elə zənn edirlər ki, xoşbəxtlik yalnız pulun çox olmasındadır. Bölünmüş, yazılmış ruzini tələb etməkdə vaxtı zay etməkdir. Ruzi artıq bölünmüşdür. Həris, tamahkar insan isə məhrumdur. Sələflər deyirlər ki: «Qədər haqdırsa onda tamahkarlıq boş şeydir. Əgər xəyanət insanın təbiətində varsa onda hər kəsə bel bağlamaq acizlikdir. Əgər ölüm hər kəsi gözləyirsə onda dünyaya da arxalanmaq axmaqlıqdır». İnsan bu ömründə uca dərəcələri və əbədi nemətləri qazana bilərdi. Lakin bu dünya malını toplayaraq bu dünyada qoyub gedir. Hesabı özünə qalır, kefi isə başqalarına. Cabir b. Abdullah - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə birlikdə Mədinənin Aliyə tərəfindən bazara daxil

---

[108] Tirmizi 2516, əl-Albani «Səhih əl-Cəmi» 7834-cü hədis.
[109] Buxari 6/61, İbn Məcə 11/216.

olduq. Ölmüş kiçik qulaqlı bir oğlaq gördü. Onun qulağından tutaraq buyurdu: «Sizdən kim bunu bir dirhəm qarşılığında almaq istər?». Səhabələr: «Allaha and olsun ki, o diri olsaydı da belə onu heç kəs almazdı. Çünkü qüsurlu oğlaqdır. Qulaqları kiçikdir» dedilər. Peyğəmbər: «Allaha and olsun ki, bu sizin üçün nə qədər dəyərsiz olduğu kimi du dünya da Allah üçün o, qədər dəyərsizdir» deyə buyurdu . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dünyanın axirətdəki durumu ancaq sizdən hər hansı bir kimsənin barmağını dənizə salıb çıxartdıqdan sonra nə çıxartdığına baxması kimidir» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şübhəsiz ki, dünyanın zəval olması Allah üçün müsəlman bir kimsənin öldürülməsindən daha xəfifdir» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizi sevindirəcək şeylərin müjdəsini sizə verirəm və bunları (gələcəkdə də) ümüd edə bilərsiniz. Allaha and olsun ki, mən sizin üçün fəqirlikdən qorxmuram. Lakin mən sizin üçün əvvəlkilərə dünyanın imkanları geniş verildiyi kimi sizə də veriləcəyindən və onlar necə bu şeydə bir-birləri ilə yarışdıqları kimi sizin də yarışacağınızı və (dünya) onları necə həlak etdisə sizi də həlak edəcəyindən qorxuram» . Sələflər deyirlər ki: «Sən fikirləşmə ki, kasıblıq varlığın olmamasıdır. Həqiqi kasıblıq dinin olmamasıdır. Ey qardaşım! Sən tamahkar insanın yığdığı mala görə ona qibtə etmə. Sizin ona yazığınız gəlsin. O, bu dünyada elə bir şeylə məşğul olub ki, sabah onu həlak edəcəkdir». Allahdan qeyrisinə (dünyaya, pula) bağlandıq-larına görə, Allahı unutduqlarına görə Allah da onları unudar və onları özlərinə həvalə edər. ***«Allahı unutduqları üçün Allahın da onları özlərinə unutdurduğu kimsələrə bənzəməyin! Onlar fasiqlərdir».*** *(əl-Həşr 19).* Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, bir gün Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına daxil oldum. O, həsirin üzərində uzanmışdır. Sonra o, qalxıb oturdu, onun əynində izardan başqa bir şey yox idi. Həsirin izi onun çiynində və böyründə qalmışdı. Mən onun eyvanına nəzər salıb gördüm ki, orada təqribən bir saa arpa, bir o, qədər akasiyə ağacının qabığı və bir də aşılanmış dəridən başqa heç bir şey yoxdur. Bu halı gördükdə mənim gözlərim yaşla doldu. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ey Xəttabın oğlu, səni ağladan nədir?». Mən: «Ey Allahı Rəsulu! Nə üçün ağlamayımda. Mən görürəm ki, həsir sənin bədənini bu hala salıb, eyvanda da gördüklərimdən başqa bir şey yoxdur. Qeysər (Rum imperatoru) və Xosrov (Fars imperatoru) cah-cəlal içərisində yaşayırlar. Sən isə Allahın Rəsulu və sevimlisi olduğun halda bu da sənin eyvanın!» dedim. Peyğəmbər: «Ey Xəttabın oğlu! Məgər istəmirsən ki, onlar üçün dünya, bizim üçün isə axirət olsun? (Başqa rəvayətdə: Dünya ilə mənim işim nə! Mənim və dünyanın misalı ancaq bir ağacın kölgəsində bir müddət oturan, sonra da oradan durub gedən bir süvariyə bənzər )» deyə buyurdu . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dünya möminin zindanı, kafirin isə Cənnətidir» .

Həqiqi azad insan kimdir. Dünyanı əlində edən, dünyanı qəlbinə salmayan kimsədir. Nə qədər dünya malı onda olarsa onu əlində saxlayar. Dünya malını Allaha itaətdə xərcləyər. İmam Əhməd – *rahmatullahi aleyhi* – dən soruşduqda ki, insanda

[110] Müslim şərhi 5/814 (Muslim «Zuhd» 2).
[111] «Səhihul Cəmi» 5423.
[112] Tirmizi 5/82, əl-Albani «Səhihul Cəmi» 453.
[113] Buxari 4/63, Müslim şərhi 5/816.
[114] Tirmizi.
[115] Müslim10/82.
[116] Müslim 2956.

min dinar olduğu halda zahid ola bilərmi? O: «Bəli, ola bilər». O, kimsə: «Ey imam bu necə ola bilər?» deyə soruşdu. O: «Artanda sevinmir, azalanda isə kədərlənmir». Tək olan Allaha ibadət edən insan varlı da ola bilər, şərəflidə ola bilər. Lakin bütün bunları əlində edər. Bunların heç birini qəlbinə salmaz. Çünkü bütün bunlar dünyanın keçici zövqüdür. Mömin kimsə qəlbini yalnız Allaha sevgi, Peyğəmbərinə itaətlə doldurur. Bu qəlb parçasını Allahdan qeyrisinə yönəltmir. ***«Bilin ki, dünya həyatı oyun-oyuncaq, bər-bəzək, bir-birinizin qarşısında öyünmək və mal-dövlət, oğul-uşaq çoxaltmaqdan ibarətdir. Bu elə bir yağışa bənzəyir ki, onun yetişdirdiyi bitki əkinçilərin xoşuna gəlir. Sonra o, quruyar və sən onun çör-çöpə döndüyünü görərsən. Axirətdə isə şiddətli əzab, Allahdan bağılanma və razılıq gözləyir. Dünya həyatı aldanışdan, yalandan başqa bir şey deyildir».*** *(əl-Hədid 20).* ***«Qadınlar, uşaqlar, qızıl-gümüş yığınları, yaxşı cins atlar, mal-qara və əkin yerləri kimi nəfsin istədiyi və arzuladığı şeylər insanlara gözəl göstərilmişdir. Lakin bütün bunlar dünya həyatının keçici zövqüdür, gözəl dönüş yeri isə Allah yanındadır».*** *(Ali-İmran 14).* ***«Dünya həyatı isə aldadıcı həzzdən, əyləncədən başqa bir şey deyildir».*** *(Ali İmran 185).* ***«Dünyanın ləzzəti və faydası azdır, lakin müttəqi üçün axirət daha xeyirlidir».*** *(ən-Nisa 77).* ***«…Dünya malı axirət yanında yalnız cüzi bir şeydir».*** *(ət-Tövbə 38).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurur: «Ölünü qəbr evinə kimi üç şey təqib edər, lakin ikisi geri dönər. Biri isə onunla bərabər qalar. Ölünü ailəsi, malı və əməli təqib edər. Nəticədə ailəsi və malı geriyə dönər. Əməli isə onunla bərabər qalar» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurur: «Kimin dərdi axirət dərdi olarsa Allah varlığı onun qəlbində edər. İşlərini düzüb qoşar, dünya istəmədiyi halda ona gələr. Əgər kimin dərdi dünya dərdi olarsa Allah kasıblığı onun qarşısında edər. Allah onun işlərini dağıdar. Ona dünyadan yazılandan başqası verilməz» . Sələflər axirət üçün yaşayardılar və axirət üçün çalışardılar. Allah da onlara dünyanı istəmədikləri halda verərdi.

Bütün bu qulluqlardan qurtaran kimdir. Tək olan, şəriki olmayan Allaha ibadət edənlərdir. Bütün dərdləri toplaşaraq bir dərdi olandan gözəl yaşayışı olan ola bilərmi. Onun dərdi bir dənədir. O, da Uca və Böyük olan Allahın razılığını qazanmaqdır. Həqiqi azadlıq da elə budur. Azadlıq başqa şeylə ola bilməz. Əgər Allaha qul deyilsə o, kimsə heç vaxt azad ola bilməz. Ya şeytanın qulu olacaqdır, ya da kiminsə? Həqiqi qulluq, azadlıq isə tək olan, ***Qahhar*** olan Allaha qul olmaqdır.

Görürsən ki, bəzi insanlar da əcəldən, ruzinin azalmasından, çətinliklərdən, xəstəliklərdən qorxurlar. Qəlbi tək olan Allaha bağlı mömin isə bu kimi şeylərdən qorxmur. İmanı zəif olan isə elə zən edir ki, artıq maaşı kəsilərsə özü və övladları da öləcəkdir. ***«Kasıblıq üzündən uşaqlarınızı öldürməyin. Sizin də, onların da ruzisini biz verəcəyik».*** *(əl-Ənam 152).* Elə zənn edir ki, filan ticarətdə uduzdusa gələcək həyatı dağılacaqdır. Bəziləri də İslamı qəbul etməkdən qorxurlar. Deyirlər ki, biz bu haqq olan kəliməni **- *Lə İləhə İlləllahı* -** desək bizə əzab-əziyyət veriləcəkdir. Bizə cürbəcür adlar veriləcəkdir. Allaha iman gətirən kimsə isə bilir ki, onun həyatı da, ruzisi də, əcəli də Allahın əlindədir. Mömin Rəbbinə inanır. Çünki əqidəsi güclüdür. Çünki bu əqidə möhkəm bir əsas üzərində qurulmuşdur. ***«Allahın risalətini təbliğ edənlər ondan qorxar, Allahdan başqa heç kəsdən qorxmazlar. Allahın çəkdiyi haqq-hesab kifayyətdir».*** *(əl-Əhzab 39).*

---

[117] Müslim 2960.
[118] Tirmizi, əl-Albani səhih.

Sən mömini dini ilə İzzət tapdığını görürsən. Sələflər – dualarında deyərdilər ki, Allahım! Məni itaətimlə izzətləndir və günahlarla alçaltma. ***«Hər kəs izzət, qüdrət, şərəf-şan istəsə bütün bunlar Allaha məxsusdur…».*** *(Fatir 10).* ***«Halbuki şərəf-şan, izzət, qüdrət yalnız Allaha, Peyğəmbərinə və möminlərə məxsusdur».*** *(əl-Munafiqun 8).* Bu mömin məğrur kafirə baxır və onlarda olan imkana, vara-dövlətə, səltənətə, elmə yuxarıdan baxır. Baxmayaraq ki, insanların çoxları bununla aldanırlar. Çünkü onlar kafirdilər. Onlar Cəhənnəmin odunudurlar. Onlar heyvan kimidirlər və bəlkə də ondan da aşağıdırlar. ***«Biz cinlərdən və insanlardan bir çoxunu Cəhənnəm üçün yaratdıq. Onların qəlbləri vardır, lakin onunla anlamazlar. Onların gözləri vardır, lakin onunla görməzlər. Onların qulaqları vardır, lakin onunla eşitməzlər. Onlar heyvan kimidirlər, bəlkə də*** *(ondan)* ***daha çox zəlalətdədirlər. Qafil olanlar da məhz onlardır».*** *(əl-Əraf 179).* ***«****(Ya Muhəmməd!)* ***Qoy kafirlər hələ yeyib-içsinlər,*** *(düyadan)* ***ləzzət alsınlar, arzuları-ümüdləri başlarını qatsın.*** *(Düçar olacaqları müsibəti)* ***sonra biləcəklər».*** *(əl-Hicr 3).*

Mömin qul haqq üzərində sücaətlə yeriyir. Bu sücaət də yalnız və yalnız Tövhiddən irəli gəlir. Onlardan biri kafirlərin qarşısında öz dini ilə İzzətlənərək deyir ki: "Allah – *subhənəhu və təalə* – bizi gətirib ki, öz istəyi ilə insanları – insanların qulluğundan Allahın qulluğuna çıxardaq. Dünyanın sıxıntısından – dünya və axirətin genişliyinə çıxardaq. Bütün dinləri zülmətdən İslamın adilliyinə çıxardaq".

***Tövhidin Cəmiyyətə (Ümmətə) Olan Təsiri*** – Tövhidin təsiri həmçinin də fərdlərə deyil bunları da aşaraq cəmiyyətə, insanlara da böyük təsiri vardır. Tövhidin ümmətlərə olan təsirindən ümmətin müstəqil olmasıdır. Ümmətin müstəqilliyi yalnız onun əqidəsində, tövhiddə müstəqilliyinə bağlıdır. Ümmət yalnız öz əqidəsi ilə müstəqil ola bilər. Bundan qeyrisi ilə müstəqil ola bilməz. Əgər ümmət tövhidə, əqidəyə bağlanmasa o, ümmət tabeçilik həyatı sürər. Bu da artıq tarixdə baş verən hadisələr gözümüzün qabağında günəş kimidir. Ərəblər Rumlulara tabe idilər. Öz aralarında baş verən işlərdə hökm vermək üçün onlara müraciət edərdilər. Onlar da bu məsələ ilə bağlı hökmlərini verərdilər. Nə vaxt ki, Allah Tövhid əqidəsini, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – i göndərdi və İslam dövləti Mədinədə böyüdü və müstəqilliyi yarandı artıq bütün ölkələrdən müstəqil oldular. Onlar hətta Əhli Kitabdan da, böyük miras sahibləri sayılan Yəhudilərdən də, Xristianlardan da, cəhalətdən də, bütpərəstlikdən də azad oldular. Bütün yer əhlindən müstəqil oldular. Bu ümmətin müstəqilliyi yalnız bu əqidənin müxtəlif vasitələrlə əkilməsindəndir. Çünki bu əqidə balacanı da, böyüyü də, yaşlı və cavanı da, qadın və kişini də yaşından və cinsindən aslı olmayaraq Allaha qul edir. Onlar əmin-amanlıqda olurlar. Çünki bu əmin-amanlıq fərdi şəxslərdən keçərək ümmətin əmin-amanlığına çevrilir.

Qureyş qorxu içərisində bir həyat sürürdü. Nə vaxt ki, Yəmən hökmüdarı Əbrəhə Kəbəni dağıtmağa gəlirdi. Qureyş dağlara qaçdı. Bütpərəstliyin heç bir köməyi olmadı. Düşmənlərə yol açıldı. Əqidəsiz insanlar düşmənə özləri yol açdılar ki, düşmən gəlib girsin. Kəbəni qurtaran kim oldu – Allah . Bu böyük hadisə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in gəlişi üçün bir hazırlıq idi. Beləliklə qureyş əmin-amanlıq diyarına çevrildi. Çünki bundan əvvəl qureyş müxtəlif tayfaların, ölkələrin hücumlarına məruz qalır və qarət olunurdu. Bu hadisədən sonra onlar dedilər ki, əgər bu böyüklükdə qoşun məhv oldusa deməli bu evin müqəddəsliyi vardır. Həmçinin də

---

[119] Bu haqda daha geniş Fil surəsindən və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in həyatı ilə bağlı kitablardan oxuya bilərsiniz.

bu evin ətrafında yaşayan qureyşlilərin də dərəcəsi vardır. Bundan sonra ətrafda olan tayfalar, ölkələr hücum barəsində düşünmürdülər. ***«Bu evin Rəbbinə*** *(Kəbənin sahibi Allaha)* ***ibadət etsinlər! O, Allah ki, onları aclıqdan qurtarıb yemək verdi və onlara qorxudan sonra əmin amanlıq bəxş etdi».*** *(əl-Qureyş 3,4).* Nə vaxt qureyş şirkin içərisində boğulurdu Allah Rəsulunu Peyğəmbər olaraq göndərdi. O, da onlara dedi ki, deyin: «***Lə İləhə İlləllah***». Onlar bu kəliməni qəbul etmədilər. Qəribə orasındadır ki, onlar bu kəliməni qəbul etməməklə yanaşı qəribə bir səbəb də gətirdilər. ***«(Qureyşlilər) dedilər: «Əgər biz səninlə birlikdə haqq yolu*** *(İslam dinini)* ***tutub getsək,*** *(müşriklərin əli ilə)* ***yurdumuzdan tezliklə didərgin salınarıq. Məgər Biz onları Özümüzdən bir ruzi olaraq hər yerin meyvəsinin*** *(hər cür meyvənin)* ***daşınıb gətirildiyi,*** *(daxilində Kəbə yerləşən)* ***qorxusuz-xətərsiz, müqəddəs bir yerdə*** *(Məkkədə)* ***sakin etmədikmi? Lakin onların əksəriyəti*** *(Allahın onlara bəxş etdiyi bu nemətin qədrini)* ***bilməz».*** *(əl-Qəsəs 57).* Onlar dedilər ki: «Sən bizim əmin-amanlığımızı pozma. Biz indi əmin-amanlıqdayıq».

Əmin-amanlığı verən kimdir? Allah! Bu göndərilən Peyğəmbər kimdir? Allahın Peyğəmbəri. Onu kim göndərib? Allah! Əgər əmin-amanlığı verən Allahdırsa, Peyğəmbəri də göndərən Allahdırsa onda Peyğəmbər göndəriləndən sonra əmin-amanlıq pozulacaq! Yoxsa əmin-amanlığın üstünə əmin-amanlıq gələcək.

Eyni sözləri indi də deyirlər. Əgər biz İslamı qəbul etsək dövlətlər bizə güləcəklər, inkişafdan geri qalacağıq, dövlətlər bizə hücum edəcəklər. Bu iddia doğru iddia deyildir. Çünki tövhid əqidəsi əmin-amanlığı əkir. Əmin-amanlığı dağıtmır. Həm daxildə, həm də düşmənlərin qəlbində. Əgər biz Allaha haqqı ilə iman gətirsək bu əqidə həm bizdə, həm də cəmiyyət də əmin-amanlıq yaradar. Əgər əmin-amanlıq istəyiriksə gərək biz əqidəyə, Allaha qayıdaq. Əgər istəyiriksə əmin-amanlığımız qorxu ilə əvəz olunsun onda biz ixtiyar sahibiyik. Çünkü qorxunun məsdəri şirkdir. ***«Haqqında heç bir dəlil nazil etmədiyi şeyi Allaha şərik qoşduqlarına görə kafirlərin ürəklərinə qorxu saldıq».*** *(Ali-İmran 151).* Əmin-amanlığın məsdəri isə Tövhiddir. ***«İman gətirib imanlarını zülmlə qarışdırmayanlar əmin-amanlıqdadırlar. Haqq yola yönəlmişlər də onlardır».*** *(əl-Ənam 82).*

İnsanların dindən uzaq düşdükləri bir gündə, şirkin baş alıb getdiyi bir gündə, yad adət-ənənələrin İslam adı ilə dinimizə daxil edildiyi bir gündə hansı əmin-amanlıqdan danışmaq olar. Dünyaya nəzər salsaq görərik ki, müsəlmanların saylarının çox olmasına baxmayaraq zəlil gündədilər. Cürbəcür təziqlərə, işkəncələrə, hücumlara məruzdular. Çünki müsəlmançılıqdan (İslamdan) yalnız adı qalıb. Əli - *radıyallahu anhu* – deyir ki: «Vaxt gələcək ki, İslamdan yalnız onun adı qalacaqdır, vaxt gələcək ki, Qurandan yalnız onun şəkili qalacaqdır, məscidlər boş qalacaqlar, qondarma alimlər çıxacaqdır». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurur: «Ümmətlərin (dövlətlərin) birləşərək sizin üzərinizə vəhşi heyvanların öz şikarlarının üzərinə hücum etdikləri kimi hücum etmələri artıq yaxındır. Səhabələrdən: «Ya Rəsulallah! Bizim sayımızın az olduğuna görə belə olacaqdır?» deyə soruşdu. Peyğəmbər: «Əksinə sizin sayınız onda çox olacaqdır. çayın gətirdiyi çör-çöp kimi. Lakin Allah düşmənlərin qəlbindən sizə qarşı olan qorxunu çıxaracaqdır. Sizin qəlbinizdə isə Allah ***Vəhm*** yerləşdirəcəkdir» deyə buyurdu. Səhabələr: «***Vəhm*** nədir ya Rəsulullah!». Peyğəmbər: «Dünyaya sevgi, ölümə isə nifrət» . Ömər – *radıyallahu anhu* – deyir ki: «Biz elə bir

---

[120] Əbu Davud 4297, Əhməd 5/278.

ümmətik ki, Allah bizi İslam ilə izzətləndirib. Əgər biz İslamdan qeyri yerdə izzət axtarsaq Allah bizi zəlil edər».

Ona görə də insan nə qədər Allahdan qorxarsa, düşmənləri də bir o, qədər ondan qorxarlar. İnsan nə qədər özü ilə Allah arasında olanı islah edərsə, Allah da onunla başqaları arasında olanları islah edər.

***Tövhidin Axirətdə Olan Təsiri*** – Olduqca böyükdür. Çünki tövhid əhli olan kimsə əbədi Cəhənnəmdə qalmaqdan qurtulacaqdır. Bu da tövhidin ən mühüm və böyük təsiridir müsəlman olan bir kimsənin həyatında. ***«Kim*** *(malını Allah yolunda)* ***versə,*** *(Allahdan)* ***qorxsa və ən gözəl sözü*** *(Lə İləhə İlləllah kəlşiməsini)* ***təsdiq etsə biz ona Cənnəti müyəssər edərik. Amma kim*** *(malını Allah yolunda xərcləməyə)* ***xəsislik etsə,*** *(mal-dövlətinə güvənib Allaha)* ***möhtac olmadığını sansa və ən gözəl sözü*** *(Lə İləhə İlləllah kəliməsini)* ***yalan saysa biz onu Cəhənnəm üçün hazırlayacağıq».*** *(əl-Leyl 5-10).* Bu haqda daha geniş axirətə iman haqqındakı bölümdə danışacağıq.

## TÖVHİDİN FAYDALARI VƏ SƏMƏRƏLƏRİ

1. Tövhidi gerçəkləşdirən, haqqını verən bir qul hesaba çəkilmədən, əzaba uğramadan Cənnətə girəcəkdir.
2. Tövhidi gerçəkləşdirmək günahların bağışlanması və kəffarəsidir.
3. Dünya və axirətin sıxıntısından, qəm və kədərindən, acısından və əzabından qurtulub hüzura və rahatlığa çıxmağın ən böyük vəsiləsi və səbəbidir.
4. Tövhid qəlbdə xardal dənəsi ağırlığından daha az miqdarda olduğu zaman Cəhənnəmdə əbədi qalmaqdan qurtarır.
5. Sahibinə hidayəti, kamilliyə çatmağı, dünya və axirətdə əmin-amanlığı təmin edər.
6. Tövhid, Allahın rizasına və savabına nail olmağın yeganə səbəbidir.
7. Zahiri və batini bütün əməllərin və sözlərin qəbulu, kamilliyə və savaba çatması tövhidə bağlıdır.
8. Tövhid qulun yaxşılıq edib, pislikdən çəkinməsini asanlaşdırır. Onu müsibətlərə qarşı səbrli edir.
9. Tövhid qəlbdə tam olduğu zaman Allah onun sahibinə imanı sevdirir. Qəlbində onu gözəl göstərir. Küfrü, üsyanı və günahı isə ona çirkin göstərir.
10. Tövhid qulu yaradılmışlara qul olmaqdan, onlara bağlanmaqdan qurtarır. Həqiqi və ən yüksək izzət və şərəf də elə budur.
11. Tövhid qəlbdə tam və kamil olduğu və tam bir ixlasla yerləşdiyi zaman əməlin azı çox olur, əməllərin və sözlərin mükafatı sayılmayacaq miqdarda qat-qat artır. Qulun tərəzisində onun ixlası göylər və yerin qarşılamayacağı qədər ağır gəlir.
12. Allah tövhid əhli olan quluna dünyada və axirətdə izzət və şərəfi, hidayəti, asanlığı, xeyirli söz və əməllərində isabətli olmağı zəmanət verir.
13. Allah iman əhli Muvahhidləri dünya və axirətin pisliklərindən qoruyar və onlara təmiz, gözəl bir həyatı ehsan edər.

## İSİM VƏ SİFƏTLƏR TÖVHİDİ

Bu ən gözəl İsim və Sifətlərin Allaha aid olduğuna haqqı ilə iman emək deməkdir. O, bütün kamil Sifətlərə malik və bütün əskik Sifətlərdən münəzzəhdir. Əhli Sünnə Vəl Cəmaat Rəbblərini Quran və Sünnədə gəlmiş İsim və Sifətlərlə bilir və tanıyır.

***«Ən gözəl adlar Allahındır. Onu bu adlarla çağırıb dua edin».*** *(əl-Əraf 180).* Allah Qurani Kərimdə özü-özünü vəsf etdiyi kimi və Rəsulu Muhəmməd – *sallallahu aleyhi və səlləm* - də Onu Sünnədə vəsf etdiyi kimi qəbul etmək. ***Onlara de: «(Bunu) sizmi, yoxsa Allahmı daha yaxşı bilir?»*** *(əl-Bəqərə 140).* Allahdan sonra onu (Allahı) Rəsulundan daha gözəl kim tanıya bilər? Rəsululah – *sallallahu aleyhi və səlləm* - bu haqda buyurur: «Sənə, sənin özü-özünə verdiyin, yaxud öz Kitabında nazil etdiyin və ya xəlq etdiklərindən birinə öyrətdiyin, və ya Öz yanında saxladığın qeyb elmində malik olduğun hər bir adla dua edirəm» . Əbu Nuaym – *rahmatullahi aleyhi* – deyir ki: «Allahın öz nəfsini vəsf etdiyi şeyləri inkar edən kafir olur. Nə Allahın özünü vəsf etdiyi, nə də Rəsulu Onu vəsf etdiyi heç bir şey təşbih deyildir» .

Allahın İsim və Sifətlərini bilmək, mənasını başa düşmək, onlarla Allaha dua edib Ondan istəmək, qulların qəlblərində yaradıcını ucaltmaq, Onu təqdis edərək hər cür əskiklik və qüsurlardan tənzih etmək və Onu sevmək, Ona ümüd edib arzulamaq və Ondan qorxmaq, Ona təvəkkül etməkdir. Belə ki, yaradıcı onların qəlblərində, nə zatında, nə də Sifətlərində heç bir ortağı olmayan ən uca örnək olur. Heç kimsənin onların qəlblərindəki bu yer kimi bir yeri yoxdur.

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in risaləsi iki şeyi əhatə edir: Faydalı elm və Saleh əməl. ***«Müşriklərin xoşuna gəlməsə də*** *(İslamı)* ***bütün dinlərin fövqündə göstərmək üçün Peyğəmbərini doğru yolla və haqq dinlə göndərən Odur!»*** *(ət-Tövbə 33).* Bu ayədə olan ***Hidayət*** **–** Faydalı elm, ***Haqq Din*** – Saleh əməldir.

***Faydalı Elm*** **–** gərək dünyada, gərək də axirətdə xeyirli və faydalı olan hər bir elmi əhatə edir. Heç şübhəsiz ki, Allahın İsimləini, Sifətlərini və feillərini bilmək bu elmlərin başında gəlir. Çünki bunları bilmək elmlərin ən xeyirlisi, ilahi risalətin özü, Peyğəmbər dəvətinin özəyi, söz, iş və etiqad baxımından dinin təməlidir. İsim və Sifətlər Tövhidi, Uluhiyyət və Rububiyyət Tövhidindən daha əhatəli və ümumidir. Allahın haqq bir İlah olduğuna, ibadətin ondan başqasına caiz olmadığını bilmək Onun İsim və Sifətlər elmindən bir budaqdır. Eyni şəkildə Onun Rəbb olduğuna, hər şeyi yaradıb yoxdan var etdiyinə, varlılıqlara surət verdiyinə iman etmək, İsim və Sifətlər Tövhidindən bir budaqdır. Bu da İsim və Sifətlər Tövhidinin Rububiyyət və Uluhiyyət Tövhidindən daha ümumi və əhatəli olduğunu göstərir.

Allahın qeyb elmində malik olduqlarını isə heç kəsin nə məhdudlaşdırması, nə də əhatə etməsi mümkündür. Allahı onun özünü adlandırdığı kimi adlandırmaq, yaxud onun özünü adlandırdığı adları inkar etmək Allaha qarşı üsyan etmək deməkdir. Ona görə də bu işdə ədəb yolunu tutmaq, Quran və Sünnə mətnlərində olan adlarla kifayətlənmək lazımdır. ***«Bilmədiyin bir şeyin ardınca getmə. Çünki qulaq, göz və qəlb bunların hamısı sorğu-sual olunacaqdır».*** *(əl-İsra 36).* ***«Allaha qarşı bilmədiyiniz şeyləri deməyinizi haram buyurmuşdu».*** *(əl-Əraf 33).*

İbn Qeyyim – *rahmatullahi aleyhi* - Allahın İsim və Sifətlərini üç qismə bölür: **1.** O, adlar ki, insanlardan qeyri məxluqlar bilir. **2.** O, adlar ki, Quran və Sünnədə varid olub. **3.** O, adlar ki, onları yalnız Allah bilir.

Əhli Sünnə Vəl Cəmaat – Rəblərini belə tanıyır. Allah, ondan əvvəl heç bir şeyin olmadığı (***Əvvəl***), ondan sonra heç bir şeyin olmadığı (***Axır***), ondan üstə heç bir şeyin olmadığı (***Zahir***), ondan o, tərəfə heç bir şeyin olmadığı (***Batindir***). ***«Əvvəl də, axır da, zahir də, batin də odur. O, hər şeyi biləndir».*** *(əl-Hədid 3).* Yenə də etiqad edirik ki,

---

[121] İmam Əhməd «Musnəd» 1/391, Həkim «əl-Müstədrək» 1/509, İbn Hibban.
[122] İmam Zəhəbi «Uluv».

Allahın zatı, digər zatlara, varlıqlara bənzəməz. Sifətləri də eyni şəkildə digər sifətlərə bənzəməz. Çünkü Allaha bənzər, oxşar heç bir varlıq yoxdur. O, yaratdığı varlılıqlarla qiyas edilməz. Allah həyatda hər şeyin xaliqi, yaradıcısı və həyatda olan hər bir varlığın ruzi vericisidir. ***«Məgər yaradan bilməzmi? Allah incəliyinə qədər biləndir,*** *(hər şeydən)* ***xəbərdardır».*** *(əl-Mulk 14).* Allah nə yaratdıqlarını yaratdıqdan sonra yaradıcı sifətini almış, nə də insanları var etdikdən sonra ***Bəri*** (yoxdan var edən) adını almışdır. Bu sifətlərə əzəldə də sahibdir. O, indi də əbədi olaraq bu sifətlərə sahibdir. Bu sifətlərin hamısı onun kamil sifətlərindəndir. Məs: O, insanları yaratdıqdan sonra yaradıcı adını almamışdır. Bütün sifətləri kimi yaradıcı sifəti də onları yaratmazdan əvvəl onda var idi. Bu sifətlər əsla və heç bir şəkildə sona yetməz. Allah var olduqca onunla birlikdə var olacaqdır. Allahın varlığının da sonu olmayacaqdır. Allah yaratdıqlarını ***Alim*** olaraq yaratmışdır və heç bir şey ondan gizli qala bilməz, heç bir şey onun elmindən qırağa çıxa bilməz. Onun elmi böyük və kiçik, çox və cüzi hər bir şeyi əhatə etmişdir. ***«Göylərdə və yerdə zərrə qədər bir şey ondan gizli qalmaz. Bundan kiçik yaxud böyük elə bir şey yoxdur ki, açıq-aydın kitabda olmasın».*** *(Səba 3).* O, kainatı yaratmazdan əvvəl nə olduğunu bildiyi kimi, hal-hazırda da hər bir şeyi bilməkdədir. Yaratdıqlarından heç bir şey ondan gizli qalmaz. ***«(Rəbbin) onların keçmişini də, gələcəyini də bilir.*** *(Ta ha 110).*

Qurandan və Sünnədən bizə Allahın **99** İsim və Sifətləri məlumdur. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: “Allahın doxsan doqquz – yüzdən bir əskik İsmi vardır. Kim bu İsimləri sayarsa Cənnətə daxil olar” . Çünki bu **99** İsmi bilmək qəlbin düzəlməsi üçün əsasdır.

Qurani Kərimdən buna dəlillər isə: ***«Şübhə yox ki, Allah çox Uca*** *(Ali)* ***və çox böyukdür*** *(Kəbirdir)».* *(ən-Nisa 34).* ***«Şübhə yox ki, Allah*** *(hər şeyi)* ***eşidən*** *(Səmi)* ***və görəndir*** *(Bəsirdir)». (ən-Nisa 58).* ***«Şübhə yox ki, Allah yenilməz qüvvət*** *(Aziz)* ***və hikmət sahibidir*** *(Hakimdir)». (ən-Nisa 56).* ***«Şübhəsiz ki, Allah bağışlayan*** *(Ğafur)* ***və rəhmlidir*** *(Rahimdir)». (ən-Nisa 23).* ***«Şübhəsiz ki, Allah sizin üzərinizdə nəzarətçidir*** *(Raqibdir)». (ən-Nisa 1).* ***«Haqq-hesab çəkməyə*** *(Hasib)* ***olaraq Allah kifayət edər».*** *(ən-Nisa 6).* ***«Allah*** *(möminlərə)* ***lütfkardır*** *(Lətif)* ***və*** *(bəndələrinin bütün əməllərindən)* ***xəbərdardır*** *(Xabirdir)». (əl-Əhzab 34).* ***«Şübhəsiz ki, Allah hər şeyi hifz edəndir*** *(Hafizdir)». (Hud 57).* ***«Şübhəsiz ki, Allah təriflənib şükr olunmağa*** *(Həmid)* ***və öyülüb, mədh edilməyə layiqdir*** *(Məciddir)». (Hud 73).* ***«Şübhəsiz ki, Allah çox yaxındır*** *(Qərib)* ***və duaları qəbul edəndir*** *(Mucibdir)». (Hud 61).* ***«Allah ehtiyacsız*** *(Ğani)* ***və həlimdir*** *(Həlimdir)». (əl-Bəqərə 263).* ***«Məgər Rəbbinin hər şeyə*** *(Şahid)* ***olması kifayət deyilmi.*** *(Fussilət 53)».* ***«Allah*** *(öz elmi ilə)* ***hər şeyi ehtiva edəndir*** *(Muhitdir)». (Fussilət 54).* ***«O, özündən başqa heç bir ilah olmayan, gizlini də, aşkarı da bilən Allahdır. O,*** *Rahməndir*, *Rəhimdir.* ***O, özündən başqa heç bir ilah olmayan*** *Məlikdir (mütləq sahibdir), Quddusdur (nöqsanlıqdan münəzzəhdir), Səlamdır (zat və sifətlərində, fellərində hər cür qüsur və əskiklikdən uzaqdır), Mumindir (öz bəndələrini şərdən qoruyan, əmin edəndir), Muheymindir (hamilik edən, qoruyandır), Əzizdir (hər şey hökmünə məhkum olan, güclü, qüvvətlidir), Cəbbardir (hökmünə məcbur edəndir), Mutəkəbbirdir (təkəbbürlük haqqına tək sahib olandır).* ***Allah müşriklərin ona qoşduğu bütlərdən uzaqdır. O, Allahdır ki,*** *Xaliqdir (hər şeyi yaradandır), Bəridir (yoxdan var edəndir), Musavvirdir (yaratdıqlarına istədiyi kimi*

[123] Buxari 6410, Müslim 2677.

*surət verəndir),* ***O,*** *Əzizdir,* ***Həlimdir*** *(yenilməz qüvvət və hikmət sahibidir)». (əl-Həşr 22-24).* və s. ayələri dəlil göstərmək olar.

Allahın Isim və Sifətləri ağılla başa düşülməz. Zənlər, düşüncələr, təsəvvürlər onu başa düşüb dərk edə bilməz. O, da yaratdıqlarına nə zatında, nə əməlində, nə də İsim və Sifətlərində bənzəməz. Kimsə deyə bilər ki, bu sifətlərə biz də məxsusuq. Amma xeyir! İnsan görmə, eşitmə sifətlərinə malikdir. Lakin onun görməsi, eşitməsi Allahın görməsi, eşitməsi kimi deyildir. Çünkü insan müəyyən bir həddə qədər görüb eşidə bilər, lakin Allah üçün belə bir hədd yoxdur. Hətta elə bir hallar olur ki, ana öz oğlunu bağışlamır. Lakin Allah öz qullarına qarşı o, qədər rəhmli və mərhəmətlidir ki, onların bu qədər günah etmələrini bağışlayır. İmam Əbu Hənifə – *rahmətullahi aleyhi* - bu haqda deyir ki: "Onun sifətləri yaratdıqlarının sifətləri kimi deyildir. Onun bilməsi bizim bilməyimiz kimi deyil. Qüdrəti var, lakin bizim qüdrətimiz kimi deyil. Görür, lakin görməsi bizim görməyimiz kimi deyil. Duyur, lakin duyması bizim duymağımıza bənzəməz. Danışır, lakin danışması bizim danışığımız kimi deyildir"[124]. Çünkü onun misli yoxdur. ***«De ki, o Allah birdir. Allah möhtac deyildir. O, nə doğmuş, nə də doğulmuşdur! Onun heç bir tayı bərabəri, bənzəri də yoxdur».*** *(əl-İxlas 1-4).*

İsim və Sifətlərin Tövhidi əqidə məsələlərində ən çətin və təhlükəli mövzulardan biridir. Hətta bir çox alimlər bu mövzuda xətalar etmişlər. Əhli Sünnə Vəl Cəmaatın bu mövzu ilə bağlı mövqeyi belədir: **1)** Nə ki, Quran və Sünnədə isbat olunub, biz də onu isbat edib, qəbul edirik. Məs: Allah görür, eşidir və s. ***«Şübhə yox ki, Allah*** *(hər şeyi)* ***eşidən*** *(SƏMİ)* ***və görəndir*** *(BƏSİRDİR)». (ən-Nisa 58).*

**2)** Nə ki, Quran və Sünnə ilə inkar edilir, biz də onu inkar edirik. Məs: Xristianlar deyirlər ki, Allah göyləri və yeri altı gündə xəlq etdi və bazar günü isə dincəldi. ***«O, nə mürgü*** *(HƏYYDİR),* ***nə də yuxu bilər*** *(QAYYUMDUR)». (əl-Bəqərə 255).* ***«And olsun ki, biz göyləri, yeri və onlar arasında olanları altı gündə yaratdıq və bizə heç bir yorğunluq da üz vermədi».*** *(Qaf 38).* Yəhudilər dedilər ki, Allah xəsisdir. ***«Xeyr, Allahın əlləri açıqdır. İstədiyi kimi lütf və ehsan edər».*** *(əl-Maidə 64).* Finhas adlı bir yəhudi Əbu Bəkr - *radıyallahu anhu –* onu İslama dəvət etdikdə demişdir: «Allaha and olsun ki, ey Əbu Bəkr! Biz fəqir (kasıb) olmadığımızdan Allaha ehtiyacımız yoxdur. O, isə fəqir birisidir. Əgər möhtac olmayan bir varlıq olmasaydı bizdən borc tələb etməzdi» ***«Allah kasıbdır, biz isə dövlətliyik! deyənlərin sözlərini Allah, əlbəttə eşitdi. Biz onların dediklərini və Peyğəmbərləri haqsız yerə öldürdüklərini yazacaq və*** *(qiyamət günü)* ***onlara: «Atəşin əzabını dadın!» deyəcəyik».*** *(Ali İmran 181)*[125]. Allah bütün bu deyilənlərdən münəzzəhdir.

**3)** Nə ki, Quran və Sünnədə varid olmayıb, sabitliyi və inkarı. Məs: Allah buyurur ki, danışır. Bu sabitdir. Lakin biz desək ki, Allah danışır, deməli dodağı, dili və s. var. Bu düz deyil. Çünkü bu haqda bizdə heç bir dəlil yoxdur. Bununla bərabər biz onu da inkar etmirik. Yenə də dəlilimiz olmadığı üçün.

## İSİM VƏ SİFƏTLƏR TÖVHİDİNDƏ MÜHÜM OLAN QAYDALAR

Müsəlman qardaş və bacılarım! Bu mövzu təhlükəli və çətin olduğuna görə, bəzi azmış və hədlərini aşmış firqələr kimi Allahın ad və sifətlərini dəyişməmək, onları heç

---

[124] «əl-Fiqhul Əkbər» s. 302.
[125] İbn Cərir ət-Təbəri təfsir kitabında. Sənədi zəifdir.

nəyə bənzətməmək, keyfiyyətini öyərənməyə çalışmamaqdan ötrü alimlər bəzi qaydalar müəyyənləşdiriblər. Bu qaydaları hər bir müsəlmanın bilməsi vacibdir.

**1.** ***Təhrif*** – bir sözü başqa sözlə əvəz etmək, dəyişdirmək deməkdir. Ayə və ya hədisi həm məna, həm də ləfzi etibarı ilə dəyişdirmək deməkdir. Məs: 1) Məna etibarı ilə təhrifə dəlil - Allah Qurani Kərimdə buyurur: ***«Rahmən ərşin üzərinə yüksəldi».*** *(Ta ha 5).* Burada olan ***İstiva*** **-** ucalmaq sözünə**,** ***Lə*** – şəkilçisi artırmaqla ***İstəvlə*** hökmü altına aldı sözü ilə əvəz edirlər. Bu azmış firqələr özləri də bilmədən Yəhudilərin etdiklərini edirlər. Allah Yəhudilərə kəndin qapsından Allaha səcdə edən halda ***Hittə*** – «Bizi bağışla» deyərək içəri daxil olun buyurduğu halda onlar Allahı ələ salaraq ***Hittə*** – sözünü, ***Hintə*** – «Buğda» sözü ilə əvəz etdərək arxaları üstə kəndə girməyə başladılar. (əl-Bəqərə 58-59) . Allahın ***Əl*** – sifətini qüdrət, nemət kimi təhrif etmək. 2) Ləfzi etibarı ilə təhrifə dəlil – Allah Qurani Kərimdə buyurur: ***«Allah Musa ilə sözlə danışdı».*** *(ən-Nisa 164)*-ci ayəsini oxuduqda: ***«Musa Allah ilə sözlə danışdı»*** deyə təhrif edirlər.

Allah Qurani Kərimdə təhrifi qınamış və bu haqda: ***«Halbuki*** *(Musa dövründə)* ***onların içərisində elələri də vardı ki, Allahın kəlamını*** *(Tövratı)* ***dinləyib anladıqdan sonra, onu bilə-bilə təhrif edirdilər».*** *(əl-Bəqərə 75).* ***«Yəhudilərin bir qismi*** *(Tövratdakı)* ***sözlərin yerini dəyişib təhrif edir…».*** *(ən-Nisa 46).* ***«Onlar sözlərin yerini dəyişib təhrif edir…».*** *(əl-Maidə 13,41).*

***Təhrif*** – ***Təvil***[127] – Kəlamçıların bir çoxu təhrif kəlməsinin yerinə təvil kəlməsini işlədirlər. Çünki Təvilin hamısı pis deyildir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – İbn Abbas – *radıyallahu anhu* – haqqında: «Allahım onu dində fəqih et! Ona təvili öyrət!» deyə buyurmuşdu . ***Təvil*** **–** təfsir mənasıdadır və sözün son nəticədə əsaslandığı həqiqət mənasını bildirir. Pislənmiş təvil – sözün bəyənilən bir mənasını kənara qoyaraq ona bənzər digər dəlili bəyənilməyən, ehtimallara əsasən şərh edilməsinə deyilir. İsim və Sifətlərdə təvilə gəldikdə isə bidət əhlinin belə bir şeyə əl atmalarında məqsəd Uca Allahı yaradılmışlara bənzərlikdən təmizləməklə həddi aşmalarıdır. Bu isə öz növbəsində batil bir iddia olmaqla onları çəkindikləri təhlükənin bir başqa formasına, daha ağırına salmaqdadır. Məs: ***Yəd*** – ***Əl*** sözünü qüdrət mənasında təvil etdikləri vaxt Allahın əlinin olmasını deməkdən qaçmaq istəmişlər. Çünki yaradılmışların da əli vardır. ***Əl*** **-** sözü onlara mütəşabih görününcə onu qüdrət adlandıraraq təvil etmişlər. Bu da onların bir ziddiyətidir. Yəni onlar məqbul saydıqları məna haqqında müvafiq bir iddia qəbul etmək məcburiyyətindədirlər. Yəni özlərinin rədd etdikləri mənanı qəbul etməyə məcburdurlar. Axı qulların da qüdrəti vardır. (Belə olduqda Allahla yaradılmışlar arasında oxşarlıq olur). Əgər onların qəbul etdikləri qüdrət haqq və mümkün olan bir şeydirsə, onda Uca Allah üçün əli məqbul saymaq da eyni qaydada haqq və məqbuldur. Əgər Uca Allah haqqında əli qəbul etmək – onların iddialarına görə təşbihi (bənzətməni) zəruri etdiyi üçün batil və mümkün olmayan bir şeydirsə, eynilə qüdrəti də qəbul etmək batil və qeyri mümkündür .

**2.** ***Tətil*** – Allahın sifətlərini təmamilə inkar etmək və ya bəzilərini qəbul edib, bəzilərini inkar etmək. Tətil mütləq olaraq Təhrifdən daha şiddətlidir. Yəni o, yerdə ki, təhrif var orada tətil də vardır. Lakin əksi belə deyildir.

---

[126] Buxari 4479.

[127] ***Təvil*** **–** sözü çevirmək, dəyişmək, sözə başqa məna vermək, ayə və hədisi zahiri mənasından çıxardıb Quran və Sünnənin demədiyi mənalara yozmaq deməkdir.

[128] Buxari, Müslim, Əhməd 1/266,314, İbn Məcə 166, Təbərani «əl-Kəbir» 10587,10617, Bəğavi «Şərhu Sunnə» 3942.

[129] Qahtani «Ulumul Quran».

***İki Qisimdir:*** 1) ***Böyük Tətil*** – Cəhmilər Allahın İsim və Sifətlərini təmamilə inkar edirlər. 2) ***Kiçik Tətil*** – Əşarilər, Mətrudilər kimi Allahın İsim və Sifətlərindən bəzilərini qəbul edib, bəzilərini isə inkar edirlər.

**3. *Təmsil*** (Muməssil) – Allahın sifətlərini məxluqatın sifətləri kimi olduğunu qeyd etmək. Buna həmçinin ***Təşbih*** – də deyilir. Bənzətmək, bənzər vermək. ***«Onun bənzəri heç bir şey yoxdur. O, eşidən və görəndir».*** *(əş-Şura 11).* Allah bu ayədə həm nəfy, həm də isbatı bir arada zikr etmişdir. Onun bənzərinin (misli) olmasını nəfy edərkən, Səmi və Bəsır (eşidən və görən) olduğunu isbat etmişdir. Bu da bu cür düşünənlərin fikirlərini alt-üst edir.

***İki Qisimdir:*** 1. Yaradılmışı Yaradana (Allaha) bənzətmək – Yəni Allahın sifətlərindən, fellərindən, haqlarından hər hansı birini yaradılmışa da vermək.

1) Allahın sifətlərindən hər hansı birini yaradılmışa vermək – Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – i və ya ondan aşağı səviyyədə olan hər hansı bir yaradılmışı tərif və övməkdə hədi aşmaq. Necə ki, Abdullah b. Yəhya əl-Buhturini tərif edən Mutənəbbi . O, deyir: «Ey bənzəri olmayan kimsə, dilədiyin kimi ol! Və necə istəyirsən elə də ol! Sənə bənzər bir kimsə yaradılmamışdır».

2) Allahın fellərindən hər hansı birini yaradılmışa vermək – Allah ilə bərabər başqa bir yaradıcı olduğunu irəli sürən kimsənin Rububiyyət tövhidində Allaha şərik qoşması.

3) Allahın haqlarından hər hansı birini yaradılmışa vermək – Müşriklərin bütlərinin ilahlıq haqqı olduğunu irəli sürərək onlara tapınıb ibadət etmələri kimi.

2. Yaradanı yaradılmışa bənzətmək – Yəni yaradılmışa aid olan bəzi özəllikləri Allahın zatına və sifətlərinə vermək. «Allahın iki əli yaratdıqlarının əlləri kimidir», «Allahın Ərşə İstiva etməsi yaratdıqlarının öz taxtlarına oturub qalxmaları kimidir» və s. bənzəri sözlər kimi. İlk olaraq bu sözləri işlədən Hişam b. əl-Həkəm[132] olmuşdur. İmam Əbu Hənifə – *rahmətullahi aleyhi* – yaradanı yaradılmışa bənzətməyi kəsin ifadələrlə qadağan etmişdir. O, deyir: «Onun sifətləri yaratdıqlarının sifətləri kimi deyildir. Onun bilməsi bizim bilməyimiz kimi deyil. Qüdrəti var, lakin bizim qüdrətimiz kimi deyil. Görür, lakin görməsi bizim görməyimiz kimi deyil. Duyur, lakin duyması bizim duymağımıza bənzəməz. Danışır, lakin danışması bizim danışığımız kimi deyildir"[133]. «Allahın əli onların əlləri üzərindədir, lakin bu yaratdıqlarının əlləri kimi deyildir. O, əllərin yaradıcısıdır. Onun üzü yaratdıqlarının üzü kimi deyildir. O, bütün üzlərin yaradıcısıdır. Onun nəfsi yaratdıqlarının nəfsi kimi deyildir. Bütün nəfslərin yaradıcısı Odur. ***«Ona bənzər heç bir şey yoxdur. O, eşidən və görəndir».*** *(əş-Şura 11)*[134].

**4. *Təkyif*** (Mukəyyif) – Allahın sifətlərinin mahiyyəti, keyfiyyəti haqqında fikir yürütmək. Sifətlərin necəliyi haqqında suallar vermək. Allahın sifətlərini bilmək lazımdır, lakin keyfiyyəti haqqında fikir yürütmək olmaz. ***«Sənə Quranı nazil edən odur. Onun bir hissəsi quranın əslini, əsasını təşkil edən möhkəm, digər qismini isə***

---

[130] Məşhur şair olub. Əsrində şairlərinin lideri idi. Zəhəbi «Siyer» 13/487, ibn Kəsir «əl-Bidayə vən Nihayə» 11/81.

[131] Əsrinin şairi, ədəbiyyatçı olub. Əsl adı Əbu Tayyib Əhməd b. Hüseyn b. Həsən əl-Cufi əl-Kufi. Peyğəmbərlik iddiasında olduğu üçün Mutənəbbi ismi ilə tanınmışdır. Bir çox şirk və batil olan şerləri vardır. Tövbə etdiyi də söylənilir. Zəhəbi «Siyer» 16/199,201.

[132] Kufəli olan Hişam kəlamçılıqla tanınmış. Dövründə İmamiyyənin rəisi sayıldığı kimi İmamiyyənin bir qolu olan Hişamiyyənin qurucusudur. Hicri 190-da ölmüşdür. İmamət haqqında, Allahı cisimləndirrmə və yaratdıqlarına xüsusilə də insana bənzətmək kimi bir çox azğınlıqlar etmişdir. Bax: «Məqalətul İslamiyyə» 1/133,134.

[133] «əl-Fiqhul Əkbər» s. 59,302.

[134] «əl-Fiqhul Əbsat» s. 52,53.

***mütəşabih*** *(mənaca bir-birinə oxşar, məğzi bəlli olmayan)* ***ayələrdir. Ürəklərində əyrilik olanlar fitnə-fəsad salmaq və istədikləri kimi məna vermək məqsədi ilə mütəşabih ayələrə uyarlar. Halbuki onların həqiqi izahını Allahdan başqa heç kəs bilməz». Elmdə qüvvətli olanlar isə: «Biz onlara inandıq, onların hamısı Rəbbimiz tərəfindəndir» deyərlər. «Bunları ancaq ağıllı adamlar dərk edər».*** *(Ali İmran 7).* Valid b. Müslüm deyir ki, əl-Əvzai, Sufyan b. Uyeynə, Məlik b. Ənəs – *rahmətullahi aleyhi* - dən İsim və Sifətlər haqqında olan hədislər barəsində soruşdum. Cavabları: «Bunları gəldikləri kimi alın, onlarla əlaqəli keyfiyyət düşünməyin» . İmam Zuhri – *rahmətullahi aleyhi* – deyir: «Risalə göndərmək Allahdan, təbliğ etmək Rəsullardan, bizə düşən isə təslimiyyət göstərməkdir» . Əbu Hənifə – *rahmətullahi aleyhi* – deyir: «Kim qulları tanıdığı kimi Allahı tanıyarsa kafir olar» . İbn əl-Cövzi – *rahmətullahi aleyhi* – İmam Əhməd – *rahmətullahi aleyhi* – ın Musaddəd əl-Bəsriyyəyə yazdığı məktubu belə xatırlayır: «Allahı onun özünü vəsf etdiyi kimi vəsf edirik, Allahın özü haqqında nəfy (inkar) etdiyini siz də nəfy edin» .

## ƏSMƏUL HUSNƏ (ƏN GÖZƏL İSİM VƏ SİFƏTLƏR)

Quran və Sünnədən bizə Allahın **99** İsimi məlumdur. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: "Allahın doxsan doqquz – yüzdən bir əskik İsmi vardır. Kim bu İsimləri sayarsa Cənnətə daxil olar" . Əsməul Husnə haqqında olan bu *Muttafiqun Aleyh* hədisi burada sona yetməkdədir. İsimləri sadalayan hədis isə Tirmizi - *rahmətullahi aleyhi* - nin «Sünnən» əsərində verilmişdir. Lakin bu rəvayət sənədində hədis alimləri tərəfindən zəif qəbul edilən Valid b. Müslim vardır ki, zəif qəbul edilmişdir. Hər nə qədər Tirmizi - *rahmətullahi aleyhi* - bu hədisi başqa yollardan rəvayət etsə də bütün bu yollar hədis alimləri tərəfindən zəif qəbul edilmişdir[140].

Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «İman **70** və ya **60** çox şöbələrdən ibarətdir. Ən fəzilətlisi, Allahdan başqa ibadətə layiq haqq ilah olmadığını - ***Lə İləhə İlləllah*** - söyləmək, ən aşağı şöbəsi isə yolda olan maneəni dəf etməkdir. Həya da imanın bir şöbəsidir» . Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: "Allahın doxsan doqquz – yüzdən bir əskik İsmi vardır. Kim bu İsimləri sayarsa Cənnətə daxil olar" . Bu kimi hədislərdə say zikr olunub, lakin təfsilatı heç bir səhih və açıq dəlildə zikr olunmayıb. Bunun da sayılması ictihad tərəfdəndir. Bu kimi hədislərdə nə kimi hikmət vardır? Say zikr olunub lakin təfsilatı verilməyib.

---

[135] İmam Bəğavi «Şərhus Sunnə».
[136] İmam Bəğavi «Şərhus Sunnə».
[137] «əl-Əqidətul Təhaviyyə» s. 25.
[138] «əl-Mənaqib» İmam Əhməd 221.
[139] Buxari 6410, Müslim 2677.
[140] ***Mudric*** - Bu o, hədisdir ki, ravi tərəfindən hədisin sənədinə və ya mətninə əlavə edilir. Buna görə də deyilir ki: Hədisin İsimlər olan bölümü ravi tərəfindən əlavədir və bu Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sözləri deyildir. Çünki Vəlid b. Müslimin - Tirmizi, İbn Hibban, Beyhəqi, Təbərani, İbn Xuzeymə, İbn Nueym – *Allah Onlardan Razı Olsun* - yolu ilə gələn rəvayətlərində İsimlər arasında böyük fərqlər vardır. İbn Teymiyyə - *rahmətullahi aleyhi* - deyir ki: "Artıq elm əhli ittifaq etmişlər ki, hər iki rəvayət – *Tirmizi, İbn Məcə* - Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sözləri deyil, bəzi Sələflərin sözləridir…". "Raddu Alə Mərisi" səh. 326, "Mədaricus Səlikin" 3/410, İbn Kəsir "Təfsir" 2/269, "Fəthul Bəri" 11/214-217, "Muhəllə" 8/31. Bax: İsim Və Sifətlər Tövhidi – Kitabına.
[141] Buxari, Müslim.
[142] Buxari 6410, Müslim 2677.

Alimlərdən bəziləri qeyd edirlər ki: Bunda Uca bir hikmət vardır. Allah bununla bəndələrindən Özünün Kitabı və Rəsulullahın Sünnəsi ilə maraqlanmağı istəyir. Onları Quran və Sünnəyə bağlamaq istəyir. Onlar öz ağıllarını bunları başa düşməkdə işlətsinlər. Əgər onlar Allahın **99** İsmini bilsələr onlarda Allah barəsində kamil bir bilik yaranar. Bununla da onlar Allahı və Onun dinini bilib tanıyarlar. Bu da imanın kamilliyidir. Elə dinin özü də budur. Ola bilər ki, bundan da başqa hikmətlər vardır. Lakin bu isə Uca bir hikmətdir. Çünki Uca Allah özünü bu İsimlərlə isimləndirmişdir. Dolayısı ilə bütün İsimlərin varacağı yer Allahdır. Hədisdə keçən «*Kim Bu İsimləri Sayarsa*» cümləsində məqsəd sadəcə bu İsimləri əzbərləyib saymaq deyildir. O, İsimlərlə Allaha qulluq etmək, dua etmək və haqqı ilə əməl etməkdir. Çünki yaxşı, pis hər insan bu İsimləri asanlıqla əzbərləyib saya bilər. Lakin onları haqqı ilə əməl etmək, saymaq qədər də asan bir iş deyildir.

Bu hədis Allahın **99** İsminin olduğunu göstərməkdədir. Lakin bu o, demək deyildir ki, Allahın bundan başqa İsimləri yoxdur. Məs: Bu o, məsələ ki: «Məndə sədəqə üçün ayırdığım yüz dirhəm pul var». Bu o, demək deyildir ki, məndə sədəqə üçün ayırmadığım başqa pullar yoxdur. Rəsululah – *sallallahu aleyhi və səlləm* - buyurur: «Sənə sənin Özünün-özünə verdiyin, yaxud Öz Kitabında nazil etdiyin və ya xəlq etdiklərindən birinə öyrətdiyin, və ya Öz yanında saxladığın qeyb elmində malik olduğun hər bir adınla dua edirəm» . Bu hədisdəki ifadələr Allahın, insanların bilmədiyi, ancaq bəzi seçilmiş qullarına öyrətdiyi, qeyb aləmində saxladığı İsimlərinin də olduğunu göstərməkdədir. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "***Əsməul Husnə*** - hər hansı bir sayla məhdudlaşmır. Çünki Allahın öz dərgahında qeyb aləmində tərcih etdiyi İsim və Sifətləri vardır. Bu İsim və Sifətləri nə Allaha yaxın bir mələk, nə də göndərilən bir Peyğəmbər bilə bilər"[144].

Bu İsimlər Allahın birliyini, mərhəmətini və üstünlüyünü göstərən, eyni zamanda qəlblərə və qulaqlara xoş gələn İsimlərdir. Hətta bu İsimlər bütün xeyir və yaxşılığa işarə edən İsimlərdir. Fəqət nə yazıq ki, insanlar bu İsimlərin mənaları haqqında görüş birliyinə varmadılar. Bu mövzuda bir çox görüşləri irəli sürərək doğru yoldan ayrıldılar. Kimiləri bu İsimləri fərqli şəkildə yozarkən, kimiləri də bu İsimləri mənaları ilə uyğunlaşmayan görüşləri irəli sürdülər. Kimiləri də birinci və ikinci qrupun dediklərini bir kənara qoymağa üstünlük verdilər. Bütün bu görüşlərin arasında Əhli Sünnə Vəl Cəmaat Allahın bu gözəl İsimlərini tərcih etdi. Bu aləmdə Allahı özündən daha yaxşı tanıyan bir varlığın olmayacağına inandılar. Bunun üçün də Allahdan yardım istəyərək insanlar arasında Allahı ən yaxşı tanıyan kimsəyə Peyğəmbərimiz Muhəmməd – *sallallahu aleyhi və səlləm* – ə üz tutdular. Onun sözlərindən doyana qədər faydalandılar. Qurtuluşlarını heç bir əyrilik və yanılma olmayan bu yolda gördülər. Bu mövzuda Allahdan sonra Peyğəmbərdən yardım istədilər. Ondan sonra da heç bir həddi aşmayaraq, təfriqəyə sapmadan ondan elm nəql edən və güvənilir, ispatlanmış ravilərin rəvayətlərindən faydalandılar. Bu üzdən Uca Allahın bu gözəl İsim və Sifətlər mövzusunda ən üstün yol Sələfi Salihin yoludur. Bu yol nə Filosofların irəli sürdükləri görüşlərə, nə də Kəlamçıların anlaşılmaz söz və düşüncələrinə dayanmır. Allahın İsimələri mövzusunda Sələfi yolu şişirtməkdən uzaq, mötədil və orta bir yoldur.

---

[143] İmam Əhməd «Musnəd» 1/391, Həkim «əl-Müstədrək» 1/509, İbn Hibban.
[144] Favaid 1/166.

***Ümmətin Sələfləri*** **-** Ərəb yarmadasından çıxan məcusilər, zındıqlar, fəlsəfəçilər, kəlam əhli, tayfa və millətlərlə qarşılaşdılar. Onlarla olan savaş yalnız qılıc savaşı deyil, qılınc savaşı ilə bərabər olan qələm, elm, Quran və əqidə savaşıdır ki, müsəlmanlar məcusi, zındıq, dinsizlik dəvətçilərinə qalib gəlmişlər. Onların şübhələrini dəf etmək, sorularına cavab vermək üçün elm adamları bu mövzuda dəyərli kitablar yazmış, İsimlərin mənalarını açıqlamış və bu İsimlərdən çıxan hikmətlər ilə faydaları insanlara bildirmişlər. Şübhəsiz ki, Uca Allahı İsimləri və Sifətləri ilə tanımaq, ən uca qayə və ən şərəfli dəyərdir. Çünki bu İsimlər Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in: «Kim bu İsimləri sayarsa Cənnətə girər» buyurması səbəbilə Cənnətə girmənin yoludur. Bu İsim və Sifətlərin bəzisi Quranda, bəzisi də Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in hədislərndə gəlmişdir. Quran və Səhih hədislərdə göstərilən Allahın İsim və Sifətlərinə inanmaq, mənalarını bilməsək də vacibdir. Bu qaynaqlarda göstərilməyən və insanların üzərində ixtilaf etdikləri İsim və Sifətləri isə haqqı ilə ortaya çıxmadıqca nə qəbul edirik, nə də inkar. Bu mövzuda nə irəli, nə də geri gedirik. Əqidə ilə əlaqəli məsələlərdə qiyas və ictihad etməyi qəbul etmərik. Ağıl sadəcə fiqhi məsələlərdə hökmləri aydınlaşdırmaq üçün Quran və hədislər işığında işlədilir. Əqidə və etiqadla bağlı mövzularda yəqinlik lazımdır, bu yerdə zən və ictihadlara yer yoxdur. Kaş ki, fiqhi məsələlərdə fətva verməkdən və ya ictihad etməkdən çəkinən, bir Muctəhidə tabe olmağı və ya hər hansı bir alimi təqlid etməyi özünə zəruri bilən bir kimsə eynilə Etiqadi və iman məsələlərində də bunu tətbiq etsəydi özü üçün daha xeyirli olardı. Çox qəribədi o, kimsənin halı fiqhi məsələlərdə İmam Əbu Hənifə – *rahmətullahi aleyhi* – belə deyir, İmam Şafii – *rahmətullahi aleyhi* – belə deyir və s. Lakin Etiqadi (əqidə) məsələlərində isə heç də İmam Əbu Hənifə, İmam Şafii – *rahmətullahi aleyhi* – dediklərini demirlər? Halbuki əqidə məsələlərində elmsiz fətva vermək fiqhi məsələlərdən daha təhlükəlidir.

İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Allaha verilən İsim və Sifətlər tam olaraq Toqifidir (Allah və Rəsulunun bildirməsi ilə bilinir)"[145]. Səid əl-Qahtani – *hafizahullah* - deyir ki: "Uca və Böyük olan Allahın İsimlərinin müzakirə ediləsi və ağılla onları təyin etmək olmaz. Ona görə də hər bir müsəlman Quran və Sünnədə gələn Allahın İsimlərilə kifayətlənməli, Allahın İsimlərinə heç bir şey əlavə etməməli və əskiltməməlidir. İnsan ağlı müstəqil olaraq Allaha hansı İsimlərin layiq olduğunu və ya layiq olmadığını təyin edə bilməz. Bütün bunları da yalnız Quran və Sünnədən bilmək olar. ***"****(Ey insan!)* ***Bilmədiyin bir şeyin ardınca getmə*** *(bacarmadığın bir işi görmə, bilmədiyin bir sözü də demə).* ***Çünki qular, göz və ürək–bunların hamısı*** *(sahibinin etdiyi əməl, dediyi söz barəsində)* ***sorğu-sual olunacaqdır".*** *(əl-İsra 36).* ***"De: "Rəbbim yalnız aşkar və gizli alçaq işləri*** *(zana etmək, lüt gəzmək və s.)****, hər cür günahı, haqsız zülmü, Allahın haqqında heç bir dəlil nazil etmədiyi hər hansı bir şeyi Ona şərik qoşmağınızı və Allaha qarşı bilmədiyiniz şeyləri deməyinizi haram buyurmuşdur".*** *(əl-Əraf 33).* Əgər bir kimsə Allahı Onun özü-özünü adlandırmadığı bir İsimlə Allahı adlandırarsa və ya Allahın özü-özünü adlandırdığı bir İsmi inkar edərsə belə bir kimsə cinayət etmiş və Allahın haqqına qəsd etmişdir. Buna görə də müsəlman bu məsələdə diqqətli olmalı, Quran və Sünnədə gələn ilə kifayətlənməlidir".

Allahın İsimləri **2** qismə bölünür. 1) Qəlbə qorxu titrətmə, salan İsimlər. 2) İnsanın qəlbinə ümüd, məhəbbət gətirən İsimlər.

---

[145] Favaid 1/162.

İnsan qəlbində tarazlıq yaratmaq üçün bu iki İsimləri də bilməlidir ki, onu xəstəliklərdən qorusun. Bu xəstəliklər də ümüdsüzlük və arxayınçılıqdır. Əgər insan tək ümüd, məhəbbət ayələrini öyrənərsə onda arxayınçılıq yaranar. Lakin tək qorxu ayələrini də öyrənməklə onda ümüdsüzlük yaranar. Bu da çox təhlükəlidir.

Allahın İsimləri Qurani Kərimin **33** surəsində keçməkdədir. Bu surələrdən bəzisi, bu İsimlərdən sadəcə birinə yer vermiş. Məs: *Tövbə, Kəhf, Məryəm, Həcc, Nəml* və s. bir çox surələr kimi. Bəzi surələr isə iki İsmi bir arada gətirmişdir. Məs: *Ənfal, Rəd, Fatir* və s. bəzi surələr isə bu İsimlərin çoxunu sadalamışdır. Məs: *Bəqərə, Ali İmran, Nisa, Həşr*. Bu İsim və Sifətlərə iman etmək və onları araşdırmaq İslamın əsası, İmanın qaydası və Ehsan ağacının meyvəsidir. Kim Uca Allahın İsim və Sifətlərini inkar edərsə elm əhli olmaqdan uzaqlaşaraq İslamın əsasını, İmanı və Ehsan ağacının meyvəsini kökündən yıxmışdır.

## BÜTÜN PEYĞƏMBƏRLƏRİN – *Allahın Onlara Salamı Və Salavatı Olsun* - ƏQİDƏNİN ƏSASLARI ÜZƏRİNDƏ İTTİFAQ ETMƏLƏRİ

Əsirlərdən boyu sabit olan ***Tövhid*** üzərində bütün Peyğəmbərlər – *Allahın Onlara Salamı Və Salavatı Olsun* - ittifaq etmişlər: **1.** Bütün nöqsan Sifətlərdən münəzzəh olan Allah Ucadır, Əzəlidir, Başlanğıcı yoxdur, birdir, mülkündə heç bir ortağı yoxdur, bənzəri, ziddi, yardımçısı, nəsihətçisi, yol göstərəni yoxdur. Yalnız Onun iznindən sonra şəfaətçi şəfaət edə bilər. **2.** Oxşarı yoxdur, bənzəri yoxdur, nə doğmuşdur, nə də doğulmuşdur. **3.** Allah Ğanidir (Nemət, Rəhmət xəzinələri sonsuz olub heç bir şeyə möhtac olmayan). Yeməz, içməz və heç bir şəkildə yaratdıqlarının ehtiyac duyduqlarına ehtiyac duymaz. **4.** O, heç bir zaman bir haldan başqa bir hala dəyişməz. İxtiyarlıq, xəstəlik, yatmaq, unutqanlıq, peşmanlıq, qorxu, kədər və s. bu kimi hallar olmaz. **5.** Yaratdıqlarından heç bir şeyə bənzəməz. Əla xüsus nə Zatında, nə Sifətlərində, nə də Fellərində Onun misli kimi bir şey yoxdur. **6.** O, yaratdıqlarından heç bir şeyə Hülul[146] etməz və yaratdıqlarından heç biri də Onun zatına Hülul etməz. O, Zatı ilə yaratdıqlarından ayrı, yaratdıqları da Ondan ayrıdır. **7.** O, hər şeydən daha Uca, hər şeydən daha böyükdür, hər şeyin üzərində, hər şeydən daha yüksəkdədir. Ondan o, tərəfə heç bir şey yoxdur. **8.** O, hər şeyə qadirdir. Dilədiyini etməkdə heç bir şey Onu aciz edə bilməz. O, hər dilədiyini edəndir. **9.** O, hər şeyi bilir. Sirri və daha gizli olanı da bilir. Olanı, olacağı, olmayanı da bilir. Olmayan əgər olsaydı necə olardı, necə olsaydı onun keyfiyyətini də bilir. Elə bir varlıq yoxdur ki, Allah onun həqiqətini bilməsin. **10.** O, Səmi və Basirdir. O, bütün səslərin fəryadını, dillər ayrı-ayrı, ehtiyaclar cürbəcür olmasına baxmayaraq onları eşidir və gecənin qaranlığında qara qayanın üzərində qara qarışqanın belə səslərini eşidir və görür. Onun Kürsüsü yerləri və göyləri əhatə etmişdir. **11.** O, qeybə sahibdir (Bilinən və Bilinməyən hər şeyə şahiddir). Mülkünün idarəsində heç kimsəni vəkil təyin etməmişdir. **12.** O, Əzəli (***Əvvəl***) və Bəqidir (***Əxir***). Zəifləməz, yox olmaz, tərk edib getməz və ölməz. **13.** O, Mutəkəllimdir (Danışan). Əmr edən və Qadağa qoyandır. Haqqı söyləyər və yol göstərər, Rəsullar göndərir, Kitablar endirir, yaxşılıq edəni mükafatlandırır, pislik

---

[146] ***Hüluliyyə*** – Allahın Zatıyla hər yerdə olduğunu qeyd edənlərdir. Onlar Allahın ***Məiyyə*** – Birlikdə, bərabər olmaq sifətində həddi aşaraq Allahın ona yaxın olan (***əl-Mukərrəbun***) şəxslərə hulul etdiyini (yəni nüfuz etmək, girmək, iki şeyin bir şeymiş kimi birləşməsini) irəli sürən sapıq firqədir.

səbəbilə cəzalandırır. İtaət olunduqda qarşılığını verən, üsyan edildikdə bağışlayandır. **14.** O, vədində sadiq, xəbərində doğru olandır. Ondan daha doğru sözlü, Ondan daha doğru xəbər verən heç kimsə yoxdur. O, əsla sözündən dönməz. **15.** O, Ucalar Ucası Saməddir. Bütün ehtiyac sahiblərinin ehtiyacını qarşılayar. Ondan daha səbirli, tərifi Ondan daha çox sevən, Bağışlamağı Ondan daha çox sevən, Ehsanı Ondan daha çox sevən kimsə yoxdur. **16.** O, Quddusdur, Səlamdır. O, hər cür ayıblardan və nöqsanlardan uzaqdır. O, Muhsindir - Ehsan etməyi sevər. Şəkurdu – şükr edənləri sevər. Tayyibdir – təmizləri sevər. Alimdir – qullarından elimli olanları sevər. Kərimdir – kərəm sahiblərini sevər. Qavidir – qüvvətli mömin zəif mömindən ona daha sevimlidir. Adildir - ədalət sahiblərini sevər. Həyy və Sittirdi – həya əhlini və iffətli bir şəkildə örtünəni sevər. Ğafur və Afuvvdur – qullarını bağışlayan və əff edəni sevər. Sadiqdir – doğru olanları sevər. Rafiqdir – mülayim və yumşaq olanları sevər. Rahimdir – mərhəmət sahiblərini sevər. Təkdir – tək olanı sevər. İsim və Sifətlərini sevər. Bu İsimlərlə ona dua edənləri sevər. Onları bilən, dərk edən, Uca Allaha həmd edən, onlarla dua edənləri də sevər. **17.** O, hər tərəfdən Kamildir. Uca Allah Zatını Sifətlərlə sifətləndirdiyini və İsimlərlə isimləndirdiyində heç bir şübhə yoxdur. Uca Allahın sevdiyini, pis gördüyünü, qəzəb etdiyini, razı olduğunu, hiddətləndiyini, dünya səmasına endiyini, Ərşinin üzərinə İstiva etdiyini, elm və həyat sahibi olduğuna, qüdrət və iradə sahibi olduğuna, mələklərin Ona yüksəldiyini, Onun qatından buyurduqlarını endirdiklərinə, eşitmək, görmək, vəch (üz) sahibi olduğuna, iki əli olduğuna, qullarının üzərində olduğuna, Muhsinlərlə, səbr edənlərlə, muttəqilərlə bərabər (***Məiyyə***) olduğuna, göylərin və yerlərin (Qiyamət günü) Onun sağ əlində olduğuna, sevinməklə, gülməklə, qullarının qəlblərinin Onun barmaqlarından iki baqmağı arasında olduğuna iman edirik. **18.** O, Adildir. Zülm etməz, əziyyət verməz, qulları Ondan zülm edər deyə qorxmazlar. **19.** Əhli İslamın dinlər arasında vasat (orta, doğru) olduğu kimi, Əhli Sünnət də əqidələr içərisində Vasatdır. Onlar Uca Allahı öz Zatını vəsf etdiyi kimi vəsf etmiş, Onun Sifətlərini inkar etməmiş, Sifətlərini məxluqatın sifətlərinə bənzətməmiş, İsim və Sifətlər barəsində Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in buyurduğundan kənara çıxmamışlar. Onlar - ***Təhrif* –** (bir sözü başqa sözlə əvəz etmək, dəyişdirmək deməkdir. Ayə və ya hədisi həm məna, həm də ləfzi etibarı ilə dəyişdirmək deməkdir). ***Tətil* –** (Allahın sifətlərini təmamilə inkar etmək və ya bəzilərini qəbul edib, bəzilərini inkar etmək). ***Təmsil*** (Muməssil) – (Allahın sifətlərini məxluqatın sifətləri kimi olduğunu qeyd etmək. Buna həmçinin ***Təşbih*** – də deyilir. Bənzətmək, bənzər vermək). ***Təkyif*** (Mukəyyif) – (Allahın sifətlərinin mahiyyəti, keyfiyyəti haqqında fikir yürütmək. Sifətlərin necəliyi haqqında suallar vermək) – kimi şeylərdən uzaq olmuşlar.

## ALLAH[147]

***Allah*** – İsmi Uca Allahın digər bütün İsimlərini əhatə edər. Əsməul Husnə olaraq bilinən bütün İsim və Sifətlər bu ada dayanırlar. Buna görə də Rahman, Rəhim, Əziz, Ğaffar Allahın adlarındandır deyilir. Lakin Allah, Rəhmanın adlarındandır deyilməz. Bu İsim Qurani Kərimdə **2697** dəfə keçməkdədir. ***«O, özündən başqa heç bir ilah olmayan, gizlini də, aşkarı da bilən Allahdır. O, Rahməndir, Rəhimdir. O, özündən başqa heç bir ilah olmayan Məlikdir*** *(mütləq sahibdir),* ***Quddusdur*** *(nöqsanlıqdan münəzzəhdir),* ***Səlamdır*** *(zat və sifətlərində, fellərində hər cür qüsur və əskiklikdən*

[147] İsim Və Sifətlər barədə daha geniş məlumat üçün bax: İsim Və Sifətlər Tövhidi – kitabına.

*uzaqdır), Mumindir (öz bəndələrini şərdən qoruyan, əmin edəndir),* ***Muheymindir*** *(hamilik edən, qoruyandır),* ***Əzizdir*** *(hər şey hökmünə məhkum olan, güclü, qüvvətlidir),* ***Cəbbardır*** *(hökmünə məcbur edəndir),* ***Mutəkəbbirdir*** *(təkəbbürlük haqqına tək sahib olandır).* ***Allah müşriklərin ona qoşduğu bütlərdən uzaqdır. O, Allahdır ki, Xaliqdir*** *(hər şeyi yaradandır),* ***Bəridir*** *(yoxdan var edəndir),* ***Musavvirdir*** *(yaratdıqlarına istədiyi kimi surət verəndir),* ***O, Əzizdir, Həlimdir*** *(yenilməz qüvvət və hikmət sahibidir)».* *(əl-Həşr 22-24).*

Kəlimələrin ən açıq olanı Allah kəliməsidir. Lakin dilçilər bu mövzu ilə böyük bir ixtilafa düşmüşdülər. ***Allah*** – İsmi hansısa bir kəlimədən törənmişdir? Yoxsa heç bir kəlimədən törənməmişdir? Əgər törənmişsə o, zaman ***Ə-Lə-Hə*** kəliməsindənmi, ***Və-Lə-Hə*** kəliməsindənmi, ***Lə-Hə*** kəliməsindənmi törənmişdir. Bütün insanlar aləmlərin Rəbbinin və göyləri, yeri yaradanın İsmi olduğunu bilirlər. Ən doğru rəy isə Allah isminin ***Əl-İləh*** kəliməsindən törəndiyidir .

## İLƏH

***əl-İləh*** – İləh, tanrı, məbud deməkdir. ***«Sizin ilahınız*** *(İLƏH)* ***tək olan Allahdır. Ondan başqa ilah yoxdur».*** *(əl-Bəqərə 163).* ***"Ey kitab əhli! Öz dininizdə həddi aşmayın! Allah barəsində yalnız haqqı deyin. Həqiqətən, Məryəm oğlu İsa əl-Məsih ancaq Allahın peyğəmbəri,*** *(Cəbrail vasitəsilə)* ***Məryəmə çatdırdığı bir söz və Onun tərəfindən olan bir ruhdur. Allaha və peyğəmbərlərinə iman gətirin.*** *(Allah barəsində)* ***"üçdür" deməyin.*** *(Belə sözlərə)* ***son qoyun ki,*** *(bu)* ***sizin üçün daha yaxşı olar. Həqiqətən, Allah tək bir tanrıdır*** *(İLƏH).* ***Övladı olmaqdan*** *(bu bəşəri xüsusiyyətdən)* ***kənardır. Göylərdə və yerdə nə varsa,*** *(hamısı)* ***Onundur. Allahın*** *(sizə)* ***vəkil olması bəs edər!".*** *(ən-Nisə 171).*

***Təbərakə*** – kəliməsi bərəkət kökündən ***Təfəalə*** – vəznində bir kəlimə olub, bərəkət, çoxluq, genişlik, bolluq və ucalar ucası deməkdir. Qurani Kərimdə bu sifət **9** yerdə keçməkdədir. ***«Aləmlərin Rəbbi olan Allah ucalar ucasıdır».*** *(əl-Əraf 54).* ***«Mütləq hökmüranlıq əlində olan Allah ucalar ucasıdır».*** *(əl-Mulk 1).* Həmçinin bu kəlimə ***Təazəmə*** – əzəmətli, ***Taharət*** – təmizlik mənalarını da verdiyini söyləmişlər.

## ƏLA

***əl-Əla*** – Ən uca, ülvi mənasındadır. Allah hər üstün və yüksək məqamın üstündədir. ***«Ən uca*** *(ƏLA)* ***olan Rəbbinin adını pak və müqəddəs tutub şəninə təriflər də!».*** *(əl-Əla 1).*

## ƏHƏD

***əl-Əhəd – əl-Vahidul-Əhəd*** – Bir və tək olan. Zatında, sifətlərində və bilgisində Allaha oxşar bir varlıq yoxdur. ***«De ki: «O, Allah birdir*** *(ƏHƏD)».* *(əl-İxlas 1).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bir nəfərin belə dediyini eşitdikdə: "***Allahummə İnniy Əs'əlukə Yə Allahu Bi Ənnəkəl-Vahidul-Əhədus-Saməd Əlləzi Ləm Yəlid Və Ləm Yuləd Və Ləm Yəkun Ləhu Kufuvən Əhəd, Ən Təğfirə Liy Zunubiy, İnnəkə Əntəl-Ğafurur-Rahim*** - Allahım, Sənə yalvarıram! Ey Allah, Sən ki,

---

[148] İbn Qeyyim «Savaikul Mursələ» s. 92, «Bədaiul Fəvaid» 2/249, Kitabu Sibaveyh 1/309.

doğmayan, doğulmayan və heç bir tayı-bərabəri olmayan Təksən, Möhtac deyilsən. Günahlarımı mənə bağışla! Şübhəsiz ki, Sən Bağışlayansan, Rəhmlisən" buyurdu: Artıq Allaha elə bir İsmi ilə dua edildi ki, əgər onunla dua edilərsə cavab verilər, istənilərsə əta olunar"[149]. O, sonu olmayan bütün bilgilərə sahibdir. Əzəldən yalnız Allah vardır. Başqa heç bir şey yoxdu. Sadəcə Allah vardı. Onunla birlikdə başqa heç bir şey yoxdur. Bütün varlıqları idarə edən və işlərini düzüb-qoşan yalnız odur. Dilədiyi bütün şeyləri etməyə qadirdir. Bütün varlıqları var edən və varlıqlarını davam etdirən Odur. Bütün varlıqların varlığ Ona bağlıdır. Onun hökmü bütün varlıqlar üzərində keçərlidir. Əmr etmək və qadağan etmək yalnız Ona aiddir. Allah dilədiyi quluna mükafat, dilədiyinə də cəza verir. Yaxşılıq edənləri mükafatlandırır, pislik edənləri isə cəzalandırır. Allah cəza üçün pisliklər, mükafat üçün isə yaxşılıqları bir səbəb olaraq təqdir etmişdir. Onun bu təqdiri qullarının bilməyəcəyi bir hikmətə dayanır. Məs: ***Ruzi*** – iki cürdür. Bədənin qidalandığı ruzi və qəlbin, ruhun qidası olan ruzi. Hər ikisi də Allahın əlindədir. ***«Allah istədiyinin ruzisini bol edər, istədiyinin ruzisini isə qıt» - Hikmət –*** Allah filankəsin ruzisini bol etməsəydi, onun azmasına səbəb olardı. Allahın hikməti onu tələb edir ki, onun ruzisi az olsun. Allah kiminsə ruzisini çox edir. Əgər az olsaydı onun Allahdan uzaqlaşmasına, Allaha qarşı qəzəblənməsinə və həmçinin də mürtəd olmasına səbəb olardı. Buna görə də Allah bilir hansı quluna varlıq xeyirdir, yoxsa kasıblıq. Bəzən də Allah quluna kasıblıq verir, ruzisini qıt edir varlı olduqdan sonra. Çünki varlı olduğu zaman azğınlıq edirdi. Bəzən də kasıb olduğu zaman düz yoldan çıxır. Nə zaman ki, ona ruzi verilir yenə də düz yola yönəlir. ***«Yer üzündə yaşayan elə bir canlı yoxdur ki, Allah onun ruzisini verməsin». (Hud 6).*** Buna görə də Allahın o, yazdığı iş (Qəza və Qədəri) bizim gözümüzdə pis görsənsə də onda böyük bir hikmət vardır. Lakin biz onu bilmirik.

Qulun Allahın bir olduğunu, mütləq və tək yaradıcı olduğunu, dilədiyi hər şeyi etməyə qadir olduğunu, təqdir etdiyi hər şeyin zamanı gəldikdə gerçəkləşdirdiyini müşahidə etməsi, onu daima Allaha sığınmaya, himayəsinə girməyə və ehtiyaclarını Ona yönəltməyə sövq edər. Həyat, ölüm, diriliş, fayda və zərər kimi şeylərdə heç bir gücə sahib olmadığını, Allahın qapısında yoxsul, aciz və miskin bir qul olduğunu bilər. Ona daha da qəlbən və səmimiyyətlə qulluq etməyə çalışar.

## ƏVVƏL – ƏXİR – ZAHİR – BATİN

***əl-Əvvəl – əl-Əxir – əz-Zahir – əl-Batin - «O, Əvvəldir, Axırdır, Zahirdir, Batindir».*** *(əl-Hədid 3).* Əbu Hureyrə *– radıyallahu anhu –* rəvayət edir ki, Peyğəmbər *– sallallahu aleyhi və səlləm –* yatağına girdikdə buyurardı: «Yeddi səmanın Rəbbi, yerin Rəbbi, hər şeyin Rəbbi, toxumu və çərdəyi yaran, Tövratı, İncili və Quranı endirən Allahım! Mən sənin alnından yaxaladığın hər şeyin şərrindən sənə sığınıram. Sən ***Əvvəlsən,*** səndən əvvəl heç bir şey yoxdur. Sən ***Axırsan,*** səndən sonra heç bir şey yoxdur. Sən ***Zahirsən***, sənin üstündə heç bir şey yoxdur. Sən ***Batinsən***, səndən o, tərəfə heç bir şey yoxdur. Mənim borcumu ödə və fəqirlikdən məni qurtar» . Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «Əvvəl, öncəsi olmayandır, Axır isə sonrası olmayandır. Çünki öncə və sonra sonu ifadə edər. Öncə varlığın başlanğıcdan öncəki sonu, sonra isə başlanğıcdan sonrakı sonu ifadə edər. Əgər varlığın başlanğıcı və sonu

---

[149] Səhih Əbu Davud 1341, Səhih İbn Məcə 3111.
[150] Müslim, Əbu Davud, Tirmizi.

olmazsa, öncəsi və sonrası da olmaz. Allah öncəsi və sonrası olmayan tək varlıqdır. Digər bütün valılıqların öncəsi və sonrası vardır» . Allahın Əvvəl olması Onun hər şeydən öncə var olduğunu, Axır olması isə hər şeydən sonra Onun var olacağını və varlığının davam edəcəyini ifadə edər. Zahir hər şeyin üstündə uca olması, Batin isə hər şeyin içində və hər şeyə əslindən də yaxın olmasıdır. Onun Zahir və üstün olmasını heç bir yer və göy gizləyə bilməz. Zahir olması Batini görməsinə mane olmaz. Çünki batində Onun üçün Zahir kimidir. Onun üçün görünməyən görünən, uzaq olan isə yaxın kimidir. Müsəlman bu İsimləri bilməklə keçici varlılıqlara bağlanmaz. Çünki keçici varlılıqlara bağlanmaq yoxluğa bağlanmaqdır. Halbuki Axır olan Allaha bağlanmaq kəsinliklə yox olmayacaq və əbədiyyən var olana bağlanmaqdır. Heç bir şey yox ikən Onun var olduğu kimi hər şey yox olduqdan sonra da Onun var olacağını bilir, daha da səmimiyyətlə Ona ibadət etməyə çalışar. Ondan başqa heç bir şeyə bel bağlamaz. Daima Ona möhtac olduğunu unutmaz. Hər şeyin Ondan başladığına və Ona da dönəcəyini xatırından çıxarmaz. O, hər şeyin əvvəli və sonudur. Allahın Batin ismini bilən kimsə Allahın hər şeydən daha çox, hətta canından da ona daha yaxın olduğunu anlayar. Zahir ismi bilməklə insanın qəlbi tək bir ilaha yönələr və ona ibadət edər.

## ƏAZZ

***əl-Əazz*** **–** Abdullah (Səfa və Mərva) Vadisində səyy etdiyi zaman dedi: "Rabbiğfirli Vərhəm, İnnəkə Əntəl Əazzul Əkram"[152].

## BƏRİ

***əl-Bəri*** **–** varlıqları yoxluqdan varlığa çıxaran deməkdir. Qurtubi – *rahmətullahi aleyhi* – deyir ki: «***Bəri*** **–** yoxdan var edən, ortaya çıxaran deməkdir». ***«O,*** *(hər şeyi)* ***yaradan, yoxdan var edən*** *(BƏRİ)* ***və*** *(hər şeyə)* ***surət verən Allahdır».*** *(əl-Həşr 24).* Buna görə də Bəri ***Bə-Rə-Ə*** kökündən gələn ***Bəriyyə*** varlıqlar, yaradılanlar mənasında işlədilir. O, halda Allah Bəri yaradandır. Çünki O. Bütün bədənləri, cisimləri yoxluqdan varlığa çıxarmışdır. Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «O, suyu, atəşi, torpağı və havanı yoxdan yaratdı. Daha sonra isə bu maddələrin qarışığından digər məxluqları yaratdı. ***«Mən palçıqdan bir insan yaradacağam».*** *(Sad 71).* ***«Sizi torpaqdan yaratması… Onun qüdrət əlamətlərindəndir».*** *(ər-Rum 20).* ***«Hər bir canlını sudan yaratdığımızı bilmirlərmi?».*** *(əl-Ənbiya 30).* ***«İnsanı saxsı kimi quru palçıqdan O, yaratdı.*** *(Cinlərin əcdadı)* ***Cannı da tüstüsüz*** *(təmiz)* ***oddan O, xəlq etdi».*** *(ər-Rahmən 14,15).*

## BƏRR

***əl-Bərr*** **–** Yaxşılıq edən, mütləq yaxşılıq sahibi, hər gözəlliyi və yaxşılığı özündə əks etdirən Uca Allahdır. Ona üsyan edilməsinə baxmayaraq yaxşılıq etməkdən vaz keçməyən və yaxşılığı kəsməyəndir. İbadət edənlərə bol-bol savab verəndir. ***«Biz bundan əvvəl Ona dünyada ibadət edirdik. Şübhəsiz ki, O yaxşılığı bol*** *(BƏRR)****, rəhm edəndir».*** *(ət-Tur 28).* Pislik edənə yaxşılıq edən, haqsızlıq edəni bağışlayan, tövbə

---

[151] Beyhəqi «Əsmə vəs Sifət» s. 10.
[152] İbn Əbi Şeybə "Musənnəf" 4/69-70.

edənin tövbəsini qəbul edəndir. Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «***Bərr* –** qullarına yumşaq davranan, onlara asanlıq diləyən, çətinlik istəməyən, bir çox günahlarını cəzalandırmadan bağışlayan, onları bütün etdiklərindən sorğuya çəkməyən, bir yaxşılığı on qat mükafatlandıran, buna qarşı pisliyi sadəcə bir misli ilə cəzalandıran, niyyət etdikləri pisliyi etmədikcə bu niyyətlərinə görə onlara pislik yazmayandır. Allah qullarına qarşı son dərəcə mərhəmətli, yumşaq və şəfqətlidir. Dualarını qəbul edər, şükrlərinə nemət verərək qarşılıq verəndir. ***«Məgər Allahın göylərdə və yerdə olanları sizə ram etdiyini və aşkar, gizli nemətlərini sizə bolluca ehsan etdiyini görmürsünüzmü?».*** *(Loğman 20).* Bu isim qullar üçün də işlədilə bilər. ***«O, həmçinin məni anama qarşı olduqca itaətkar və nəvazişkar*** *(BƏRRAN)* ***etdi».*** *(Məryəm 32).* ***«Yəhya ata-anasına qarşı da olduqca itaətkar və nəvazişkar*** *(BƏRRAN)* ***idi».*** *(Məryəm 14).*

## BƏSİR

***əl-Bəsir*** – görən olmasının mənası isə hər nə qədər incə və hiss edilməz kimi görünürsə və ya uzaq olursa olsun hər bir şeyi gözəl bir şəkildə idrak edən (görən) deməkdir. ***Bəsir*** – həmçinin də elmə, bilməyə də dəlalət edir. Allah qəlbdəki fısıltıları, beyindəki hisləri, fikirdəki gizlilikləri görür və bilir. ***«Həqiqətən Allah eşidən və görəndir».*** *(əl-Mucadələ 1).* Bu aləmdə olan ən kiçik parçaları, ən cüzi qarışqanı da belə, orqanlarını, ətini, qanını, beynini və damarlarını da görəndir. Yeddi qat göyün üzərində olanı gördüyü kimi, yeddi qat yerin altında olanı da görür. Allah yer və göylərin hər yerində görüləbiləcək hər şeyi Bəsir sifəti ilə onları görməktədir. Onun üçün görülməyən bir şey yoxdur. Heç bir şey Ondan gizli deyildir. O, görünəni və görünməyəni, hazır olanı və olmayanı görəndir. Hətta gözlərin hərəkətlərini, qəlb atışlarını və ağıla gələn düşüncələri dahi bilən və görəndir. ***«(Allah) gözlərin xainliklərini və köksların saxlamaqda olduqlarını biləndir».*** *(əl-Mumin 19).* İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Bəsir və Bəsirət arasında fərq olduğunu söyləyir. Bəsir yuxarıda söylədiyimiz kimi. Bəsirəti isə belə açıqlayır: «Bəsirət, Allahın qəlbə atdığı bir nurdur. Qəlbinə belə bir nur atılan kimsə, Peyğəmbərlərin xəbər verdiyi həqiqətləri görür. Belə ki, bunları sanki gözü ilə görməkdədir. Beləcə Peyğəmbərlərin dəvət etdiyi şeylərdən ən üstün dərəcədə faydalanır. Bu Bəsirətin dərəcələri vardır. Bunların hamısını əldə edən kimsənin Bəsirəti kamilliyə çatar. 1. İsim və Sifətlərdə Bəsirət. 2. Əmir və Qadağalarda Bəsirət. 3. Savab və Cəzada Bəsirət. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şübhə yox ki, Allah haqqı ilə eşidən və haqqı ilə görəndir ayəsini oxuduqdan sonra baş barmağını qulağının, şəhadət barmağını isə gözünün üstünə qoydu» .

## BƏQİ

***əl-Bəqi – «Cəlal və Kərəm sahibi olan Rəbbinin üzü Bəqi qalacaqdır».*** *(ər-Rahmən 27).* ***«Allah daha xeyirli və daha Bəqidir».*** *(Ta ha 73).* Allahın əvvəli olmadan var olan bir varlıq olduğuna görə varlığının son olması və yox olması mümkün olmamalıdır. O, varlığının başlanğıcı və sonu olmayan tək varlıqdır. Allahın

---

[153] Səhih Sünnən Əbu Davud 3/895, «Avnul Məbud» 13/37, İbn Həcər «Fəthul Bəri» 13/375.

Bəqi olması əsla ölməyən həyat sahibi. Əbədi varlıq olması deməkdir. Bütün varlılıqlar yox olacaqdır, sadəccə onun varlığı davam edəcəkdir .

## BƏDİ’

***əl-Bədi’- «Göyləri və yeri icad edən** (BƏDİ yoxdan yaradan)* ***Odur».*** *(əl-Bəqərə 117).* ***«O, göyləri və yeri** (BƏDİ yoxdan)* ***var edəndir».*** *(əl-Ənam 101).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ey Allahım! Həmd yalnız Sənədir. Səndən başqa İlah yoxdur. Sən verdiyin nemətləri başa qalxmazsan. Göyləri və yeri heç bir bənzəri olmadan yaradan Sənsən. Sən ucasan və ikram sahibisən. Səndən Cənnəti istəyir və Cəhənnəmdən Sənə sığınırıq» . Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – dua edərək buyurdu: «…***Yə Bədiəs Səməvəti Vəl Ərd*** – Ey səmaların və yerin yaradıcısı…» . İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: «***Bədi –*** Öncə bir misli, oxşarı olmadan yaradan, ortaya çıxaran, var edən deməkdir» . Qurtubi – *rahmətullahi aleyhi* – deyir ki: «Daha öncə bir şəkili, modeli olmadan yoxdan var edən, icad edən deməkdir» . Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «Daha öncə heç bir bənzəri olmayan bir şeyi yaradandır». Allahın heç bir bənzəri və nümunəsi yoxdur.

## BƏSİT – QABİD

***əl-Bəsit – əl-Qabid –*** Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in dövründə qiymətlər artmağa başladı. İnsanlar: “Ey Allahın Rəsulu! Qiymətlər artdı. Bizə bir qiymət təyin et (Qiymətlərə hədd qoy)” dedilər. Peyğəmbər: “Qiymətləri tənzimliyən Allahdır, Genişlədib çox-çox verən Allahdır, Ruzi verən Allahdır, Daraldıb qıtlıq gətirən də Allahdır. Mən Allaha yanımda kimsənin mal və qan haqqı olamadığı halda çatmağı ümüd edirəm” deyə buyurdu . ***Bəsit – Bəsətə*** felindən olan açan, yayan, bol verən, genişlədən, əli açıq deməkdir. Qabid isə ***Qabaza*** felindən olan tutan, malik olan, daraldan, az verən mənasındadır. Bəsit bəzəndə güc mənasında da işlədilir. ***«Sən məni öldürməkdən ötrü mənə əl qaldırsan da, mən səni öldürmək üçün sənə əl qaldıran deyiləm** (BƏSİTUN)».* *(əl-Maidə 28).* Allah Bəsit və Qabiddir. Varlılıqların ruzisini dilərsə bol verər, dilərsə də daraldır. O, dilərsə verir. Dilərsə verməz. Dilədiyinin ruzisini bol etməklə onu sevindirər. Ehtiyaclarını ödəyərək digər qullarından daha üstün tutar. Dilədiyinin ruzisini də daraldar. Onu möhtac edər, rahat yaşamaqdan məhrum edər və onu yoxsulaşdırar.

Bu İsimlərdən xəbərdar olan hər bir müsəlman onda olan o, dini elmlərlə insanlar arasında oturub gülər üzlə və şirin dillə onlara nəsihətlər etməlidir. Sənin biliyində və mərifətindən faydalansınlar və səni örnək etsinlər. Əgər güc və qüvvət sahibisənsə bu güc və qüvvətini səni sevincə qovuşduracaq ibadətlərdə və Allah düşmənlərinə qarşı işlət. Əgər var-dövlət sahibisənsə, mal və mülkün çoxdursa insanlara yardım etmək

---

[154] İbn Kəsir 8/378, Qurtubi 9/6565.
[155] Tirmizi 3544, Əbu Davud 1495.
[156] Əbu Davud 2/80, İbn Məcə 2/1268, Nəsəi 3/52, Tirmizi 5/550.
[157] İbn Kəsir 3/223.
[158] Qurtubi 1/580.
[159] Əbu Davud 3451, Tirmizi 1314, əl-Albani “Səhih Sünən Tirmizi” 2/32, “Səhih Sünən İbn Məcə” 2/15.

üçün əlini aç, malını gizlətmə. Əlini simic etmə ki, Allah da sənə daha çox versin. Etdiyin yaxşılıqları sayma ki, Allah da sənə hesablı davranmasın. Əgər bu nemətlərdən hər hansı birinə sahib deyilsənsə qəlbini Allahın hökmlərinə aç, dilinlə Onu daimə zikr və şükr et, insanlarla gülər üzlə davran. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yaxşılıq edəcək malı və gücü olmayan kimsə qardaşını gülər üzlə qarşılasın» .

## TƏVVAB

***ət-Təvvab*** – Tövbələri qəbul edən deməkdir. ***«Şübhəsiz ki, O tövbələri qəbul edəndir».*** *(əl-Bəqərə 37).* ***«Allah tövbələrinizi qəbul etmək istər».*** *(ən-Nisa 27).* ***«Qullarından tövbəni qəbul edən Odur».*** *(əş-Şura 25).* ***Tövbə*** – günah olan şeydən dönmək, onu tərk etmək deməkdir. Qulun tövbə etməsi Allahın əmr və qadağalarına üsyan etməkdən vaz keçib, bu əmr və qadağalara uyğun hərəkət etməkdir. Üsyanı buraxıb itaətə dönməkdir. Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «***Təvvəb*** – qullarının tövbələrini qəbul edəndir. Allah qulu tövbəyə müvəffəq edər, qul tövbə etdikdə tövbəsini qəbul edər. ***«Sonra tövbə etsinlər deyə onların tövbəsini qəbul etdi».*** *(ət-Tövbə 118).* ***Təvvəb*** – Qullarının tövbə yollarını asanlaşdırandır. İman özündən əvvəlki günahları silib yox etdiyi kimi, tövbə də özündən əvvəlki günahları silib yox edər. ***«Ancaq tövbə edib iman gətirən və yaxşı işlər görənlərdən başqa! Allah onların pis əməllərini yaxşı əməllərə çevirər. Allah bağışlayan və rəhm edəndir! Hər kəs tövbə edib yaxşı iş görərsə, o şübhəsiz ki, Allaha yaxşı bir dönüşlə dönər».*** *(əl-Furqan 70,71).* İman və tövbə, hər ikisi də qəlblə əlaqəli əməllərdir. İman, qul Allaha təslim olmadıqca Onun əmr və qadağalarına uymadıqca tamamlanmadığı kimi tövbə də günahları tərk etmədikcə tamamlanmaz. Tövbə imanın bir parçasıdır.

## CƏBBAR

***əl-Cəbbar*** – Cəbr kökündən gəlməkdədir. Hər hansı bir şeyi islah etmək, düzəltmək deməkdir. Bir kimsəni fəqirlikdən qurtararaq zənginləşdirmək və ya qırılan sümükləri düzəltməkdir. ***«O, özündən başqa heç bir ilah olmayan, gizlini də, aşkarı da bilən Allahdır. Cəbbardır** (hökmünə məcbur edəndir)».* *(əl-Həşr 22-24).* əl-Accac öz şerində deyir: «Allah dini tamamladı və o, dində tamamlandı» . ***Əf-Alə*** vəznində işlədilən hökmüranlıq, məcbur etmək: ***Əcbərtuhu Alə Kəzə*** – onu belə etməyə məcbur etdim. İmam Şafii – *rahmətullahi aleyhi* – deyir ki: «Sultan onu məcbur etdi». Əl çatılmaz, yüksək, əl çatmayan xurma ağacına ***Nəhlətun Cəbbar*** deyilir. ***«Ya Musa! Orada nəhəng adamlar vardır».*** *(əl-Maidə 22).* Bir kimsə uzun boylu, iri və qüvvətli olduğu zaman yüksək olan xurma ağacına bənzədilərək ***Raculun Cəbbar*** deyilir. İbn Abbas – *radıyallahu anhu* - deyir ki: «Cəbbar, ulu və uca deməkdir. ***Cəbərutullah***. Allahın əzəməti və ucalığı deməkdir». Bu Sifət üç mənaya dayanır. Hökmüranlıq, üstünlük və ucalıq. Zəifləri düşdükləri vəziyyətdən qurtarmaq, Onun yolunda qırılmış qəlbləri düzəldən, yoxsulları zənginləşdirən, çətinlikdə olana hər çətinliyi asanlaşdıran, müsibətə uğrayana güc və qüvvət verərək səbr etməsini, əcr qazanmasına, ucalığına boyun əyənlərin qəlblərinə bir mutluluq və sevinc verəndir. Bütün varlıqlar Ona boyun

---

[160] Tirmizi 2722.
[161] İbn Mənzur «Lisanul Arab» ***Cə-Bə-Rə*** maddəsi.

əyər. Hər kəs Onun əmrlərinə uymaq məcburiyyətindədirlər. Allah əmr edilən deyil, əmr verəndir. O, məğlub deyil, qalib olandır. Uca Allah qulları arasında özlərini Cəbbar (üstün güc sahibi, zorba) olaraq göstərənləri pisləmişdir. ***«Allah hər təkəbbür sahibinin, zalımın ürəyini belə möhürləyir».*** *(əl-Mumin 35).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yer üzündə təkəbbürlü və zorba olanlar qiyamət günündə insanların üzərinə basdıqları qarışqalar kimi diriləcəklər»   .

# CƏMİL

***əl-Cəmil*** **–** Uca Allahın gözəl İsimlərindəndir. Varlıq aləmində hər gözəlliyin sahibindən daha gözəldir. Hətta bütün varlılıqların gözəlliyi bir adamda toplansa yenə də bu gözəllikləri Allahın gözəlliyinin yanında günəş işığı qarşısında zəif qəndil işığına bənzər. Bu aləmdə var olan bütün gözəlliklər Onun bir sənət əsəridir. Gözəllikləri yaradan Odur. O, bütün gözəl isim, sifət və fellərin sahibidir. Ən gözəl İsimlər Ona aiddir. Bu dünya həyatında heç bir insan Onun cəlalına və camalına tamaşa etməyə güc yetirməz. Cənnətdə Onu gördükdə isə bu onlara içində olduqları bütün nemətləri unutdurur. O, an Ondan başqa heç bir şeyə dönüb baxmazlar. Əgər üzündəki nur pərdəsi olmasa üzündəki o, nur Ona baxan bütün gözləri yandırardı. Əbu Musa - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah yatmır. O, yatmamalıdır ki, Mizanı (başqa rəvayətdə ədaləti) endirsin və ya qaldırsın. Gündüzün əməlindən əvvəl gecənin əməli, gecənin əməlindən əvvəl gündüzün əməli ona (Allaha) yüksəlir (qaldırılır) Onun örtüyü (pərdəsi) nurdur. (Əbu Bəkr - *radıyallahu anhu* – nun rəvayətində pərdəsi atəşdir). Əgər üzündəki pərdəni qaldırsa üzünün nurları yaratdığı hər bir şeyi yandırar   . Bu İsim Qurani Kərimdə keçməməkdədir. Yalnız İbn Məsud – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Heç şübhəsiz ki, Allah Cəmildir (gözəldir) və gözəl olanıda sevir»   . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Allah gözəldir və gözəldən başqasını da qəbul etməz»   . Gözəllik insanın zahiri görnüşünü əhatə etdiyi kimi (geyim, saç), bundan başqa olan bütün gözəl şeyləri də əhatə edir. Çünki Allah verdiyi nemətlərin əsərini qulların üzərində görməsindən xoşlanır. Çünki bu sevdiyi gözəllikdəndir. Buna görə də Allahın verdiyi nemətlərə şükr edən kimsə, bu nemətləri yerinə yetirməli və istifadə etməlidir. İstifadə etmək zahiri gözəllik, dil və qəlb ilə şükr isə daxili gözəllikdir. ***«O, yaratdığı hər şeyi gözəl yaratdı».*** *(əs-Səcdə 7).* ***«Ey Adəm oğulları! Sizə ayıb yerlərinizi örtəcək bir geyim və bir də bəzəkli libas nazil etdik. Lakin təqva libası daha yaxşıdır».*** *(əl-Əraf 26).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Allah nemətinin əsərini, qulunun üzərində görməyi sevər»   . Əbul Əhvas əl-Cəşmi deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – üzərimdə köhnə və cırılmış paltar gördü və buyurdu: «Malın varmı?». Mən: «Bəli» dedim. O: «Nəyin var?» deyə buyurdu. Mən: «Dəvələrim və qoyunlarım» dedim. O: «O, halda sənə verdiyi bu nemət və qayğını üzərində göstər» deyə buyurdu   .

---

[162] Tirmizi 2492.
[163] Müslim, İmam Əhməd 4/395,401, İbn Məcə 195, Darimi «ər-Rədd aləl Mərisi» s. 173, Beyhəqi «Əsmə və Sifət» s. 402, əl-Albani «Muhtasarul Uluvv» s. 86, «Səhih Cəmius Səğir» 1860.
[164] Müslim 1/93, H. 147.
[165] Müslim 1015.
[166] Tirmizi 2819.
[167] Əbu Davud 4063.

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Qəlbində zərrə qədər təkəbbürlük olan kimsə Cənnətə girməz». Səhabələrdən biri: «Ya Rəsulullah! Əgər biri gözəl geyinmək, gözəl ayaqqabı, gözəl oturuş və gözəl miniyi olmasını istəyir? Bu da təkəbbürlükdür» deyə soruşdu. Peyğəmbər: «Yox, həqiqətən də Allah gözəldir və gözəl olanı da sevir. Təkəbbürlük isə haqqı danmaq və insanlara xor baxmaqdır» deyə buyurdu . Allah gözəl sözləri, felləri, paltarları və gözəl görünməyi sevdiyi kimi çirkin sözləri, felləri, paltarları və çirkin görünməyi də sevməz. Qısaca Allah çirkinliyi və çirkini sevməz, gözəlliyi və gözəli isə sevər. Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, bir gün: «Yəhudilər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanından keçərkən (onu ələ salaraq): «***Əs-Səmu Aleykə*** – ölüm üzərinə olsun» dedilər. Peyğəmbər də: «***Və Aleykum*** – sizin üzərinizədə» deyə buyurdu. Aişə - *radıyallahu anhə* – bu şeylərə dözməyərək: «Ölüm də üzərinizə olsun, Allahın lənəti üzərinizə olsun və Allah sizə qəzəb etsin» dedi. Peyğəmbər: «Yavaş ol, ey Aişə, yavaş və yumşaq davran. Sərtlikdən və çirkin sözlər söyləməkdən çəkin (Başqa rəvayətdə: Çirkin söz söyləyən birisi olma! Çünki uca Allah çirkin söz söyləməyi, çirkin sözləri işlətməyi sevməz) Mən onlara qarşılıq verdim. Mənim söylədiyim qəbul olunur. Lakin onların mənim üçün söylədikləri isə qəbul olunmaz» deyə buyurdu . ***«Halbuki biz onlardan əvvəl neçə-neçə nəsilləri məhv etdik ki, onlar mal-dövlət və simaca bu kafirlərdən daha üstün idilər».*** *(Məryəm 74).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah sizin surətinizə və mallarınıza baxmaz. Lakin O, sizin qəlblərinizə və əməllərinizə baxar» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim təkəbbürlü olaraq yeriyərsə və təkəbbürlü olaraq danışarsa Cənnətə girməz» .

## CƏMİ’

***əl-Cəmi’*** **–** Bir yerə gətirmək, dağınıq olan şeyləri toplamaq mənasındadır. ***«Rəbbimiz olacağına şübhə edilməyən bir gündə bütün insanları toplayan sənsən, Allah öz vədəsindən əsla dönməz».*** *(Ali İmran 9).* ***«Allah sizi toplanma gününə cəm edəcəyi gün…».*** *(ət-Təğabun 9).* ***«Həqiqətən Allah münafiqləri və kafirlərin hamısını Cəhənnəmdə bir yerdə toplayacaqdır».*** *(ən-Nisa 140).* ***Cəmi*** **–** həm zatı. Həm də feli sifətdir. Zatı olaraq Allahın bütün gözəllikləri və fəzilətləri özündə toplaması və bunlara sahib olma mənasındadır. Feli olaraq isə Allah sevən qəlbləri bir yerə toplaması, ölümündən sonra dağınıq, yox olan bədən parçalarını təkrar dirilməklə bir yerə gətirən, ruhu və bədəni birləşdirən Odur. ***«Əgər sən yer üzündə nə varsa hamısını xərcləsəydin belə yenə də onların ürəklərini birləşdirə bilməzdin. Lakin Allah onları birləşdirdi. Çünki O, yenilməz qüvvət və hikmət sahibidir».*** *(əl-Ənfal 63).* İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: «***Cəmi*** **–** Allah qiyamət günü bütün insanları yenidən diriltdikdən sonra hüzurunda toplayacaqdır» .

[168] Müslim.
[169] Buxari, Müslim.
[170] Müslim 2064
[171] Əbu Davud.
[172] İbn Kəsir 2/12.

## CƏVAD

***əl-Cəvad –*** Peyğəmbər *– sallallahu aleyhi və səlləm –* buyurdu: "Həqiqətən Allah gözəldir və gözəl olanı da sevir. Pakdır və pak (təmiz) olanı da sevir. Kərəm sahibidir və kəramətli olanı da sevir, səxavətlidir və səxavətli olanı da sevir"[173].

## CƏLİL

***əl-Cəlil - "Ancaq əzəmət və kərəm sahibi olan Rəbbinin zatı baqidir".*** *(ər-Rahmən 27).*

## HĀFİZ – HƏFİZ

***əl-Hāfiz*** – Qoruyan, mühafizə edən deməkdir. ***«Heç şübhəsiz ki, Quranı biz nazil etdik və biz də onu qoruyacağıq*** *(HĀFİZ)****».*** *(əl-Hicr 9).* ***"****(Yəqub)* ***dedi: "Bundan əvvəl qardaşını*** *(Yusifi)* ***sizə etibar etdiyim kimi, heç onu sizə etibar edə bilərəmmi? Allah Özü*** *(onu)* ***ən yaxşı qoruyandır və rəhmlilərin ən rəhmlisidir!".*** *(Yusuf 64).* Həlimi *– rahmətullahi aleyhi –* deyir ki: «Hāfiz qullarını din və dünya işlərində təhlükələrdən qoruyan deməkdir». Əbu Hureyrə - *radıyallahu anhu –* rəvayət edir ki, Rəsulullah *– sallallahu aleyhi və səlləm –* buyurdu: «Sizdən biriniz yatağına təkrar dönərsə paltarının ətəyi ilə yatağını silsin və Allahın adını söyləsin. Çünki yatan kimsə ondan sonra yatağına hansı məxluqun girdiyini bilməz. Yatmaq istədiyi zaman sağ yanı üzərə uzanaraq belə dua etsin: Ya Rəbbim! Sən bütün nöqsanlıqlardan uzaqsan. Ya Rəbbim! Sənin adınla yatağıma uzandım və yenə də Sənin adınla qalxıram. Əgər canımı alacaqsansa ona məğfirət et. Əgər sağ qalacağamsa onda saleh qullarını qoruduğun kimi məni də qoru» .

***əl-Həfiz –*** Allah qullarına qarşı həfiz – qoruyan və himayə edəndir. Hər müsəlman bütün şeyləri qoruyanın uca Allah olduğunu, Onun Həfiz olduğunu bilməlidir. Allah bizi, söz, əməl və mələkləri ilə qullarını qoruyur. ***"Əslində*** *(İblisin)* ***onlar üzərində heç bir hökmü yoxdur. Lakin Biz axirətə inananla ona şəkk edəni ayırd edib bilmək üçün*** *(İblisə bu imkanı verdik)****. Sənin Rəbbin hər şeyi hifz edəndir!*** *(Möminlərin və kafirlərin əməllərini mühafizə edər, qiyamət günü hərəyə öz əməlinin cəzasını verər)****".*** *(Səba 21).* ***«Allahdan başqasını dost tutanlar üzərində Allah özü nəzarətçidir*** *(HƏFİZDİR)****».*** *(əş-Şura 6).* ***Həfiz –*** sıxıntı anında səni şikayət etməkdən qoruyan, nemət zamanında da səni fəlakətlərdən qoruyandır. AbdurRahman əs-Sədi *– rahmətullahi aleyhi –* deyir ki, bu İsmin iki mənası vardır. 1. ***Həfiz –*** qullarının xeyir, şərr, qəbul, inkar, itaət və günah etdiklərini qoruyandır. Çünki zərrə miqdarı belə olsa, bunlarla əlaqəli heç bir şey Ondan qaçmaz. Onun bu əməlləri qoruması, bu əməlləri nəzarət altına alması və hesabını etməsi deməkdir. Onun elmi qullarının açıq və gizli bütün əməllərini əhatə edir. O, bu əməlləri, bu əməllər meydana gəlmədən əvvəl, hətta göyləri və yerləri yaratmadan əvvəl Lövhi Məhfizda yazmışdır. Allah qullarının bu əməllərini nəzarət etmək işini Hafizi, Kiramən Kətibin mələklərinə vermişdir. Çünki bu mələklər qulların nə etdiklərini bilirlər. 2. ***Həfiz –*** Allahın qullarını xoş olmayan bütün şeylərdən qorumasıdır. Allahın qullarını qoruması isə iki cürdür. **1)** ***Ümumi***

---

[173] Tirmizi 2799, 2495, əl-Albani «Səhihul Cəmi» 1796.
[174] Buxari 6320, Müslim 2714.

***Qoruma*** – Allahın yaratdıqlarını, güclərinin yetəcəyi və niyyət etdikləri şeyləri onlara asanlaşdırmaq surətilə qorumasıdır. Onlar Onun hidayətinə və öz məsləhətlərinə uyğun şeylərə Allahın irşadı və hidayəti sayəsində çatırlar. ***«Rəbbimiz hər şeyə öz surətini, şəklini verən sonra ona doğru yolu göstərən Allahdır!».*** *(Ta ha 50).* Hər bir varlığa zərurətlərinə və ehtiyaclarına görə doğru yolu göstərir. Sonra da ona təqdir edilən yemək, içmək və bunları qazanmaqda vəsilələr və alətlər verir. Əgər Allahın bütün varlılıqları qoruması olmasaydı varlığı mümkün olan heç bir şeyin varlığı davam etməzdi. Allah bütün varlılıqları təkrar yoxluğa dönməkdən qorumuşdur. Göyləri yerə düşməkdən qoruyan və tutan Odur. ***«Həqiqətən Allah göyləri və yeri zaval tapmasınlar deyə tutub saxlayır. Əgər onlar öz mehvərindən çıxsalar Allahdan başqa onları kim tutub saxlaya bilər. Doğurdan da Allah həlim və bağışlayandır».*** *(Fatir 41).* **2)** ***Xüsusi Qoruma*** – bu da Allahın öz dostlarını xüsusi olaraq qorumasıdır. Çünki Uca Allah dostlarını onların imanlarına zərər verəcək və inanclarını sarsıdacaq fitnələrdən, şübhələrdən və şəhvətlərdən qoruyar. Bu cür zərərli şeylərdən onları uzaq tutar və onları salamat edər. Onları cin və insanlardan olan düşmənlərdən qoruyar. Düşmənlərinə qarşı onlara yardım edər. Düşmənlərinin hilələrini onlardan uzaqlaşdırar. ***«Şübhəsiz ki, Allah iman gətirən kəslərdən*** *(kafirlərin əzab-əziyyətini)* ***dəf edər. Allah həqiqətən heç bir xain və nankoru sevməz!».*** *(əl-Həcc 38).* Ən mühüm qoruması isə qəlbləri qorumasıdır. Müsəlmanın dinini hər cür küfr, nifaq, fitnə, hədsiz arzu və istəklərdən, bidətlərdən qoruması qorumaların ən böyüyüdür. Çünki bu sayədə müsəlman doğru yoldan ayrılıb başqa yollara sapmaqdan qurtulur. ***«Allah iman edənləri dünya və axirətdə möhkəm bir sözlə sabit-qədəm edər».*** *(İbrahim 27).* Əgər bu cür qoruma olmasa insan Cəhənnəmə girər.

Abdullah b. Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, bir gün (minikdə) Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in arxasında oturmuşdum. O, buyurdu: «Ey oğul! Mən sənə bir neçə kəlimə öyrədəcəm. Allahı qoru ki, Allah da səni qorusun. Allahı qoru ki, onu öz qarşında tapasan»[175]. Burada Allahı qorumaqda məqsəd onun əmrlərini yerinə yetirərək qadağalarından çəkinərək və qoyduqları sərhədləri aşmayaraq qorumaqdır. Sən belə davrandıqda O, da sənin dinini, malını, uşaqlarını və özünü hər bir şeydən qoruyar. Əbu Suleyman Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «Hāfiz, Həfiz mənasındadır. Qadir ilə Qədir, Alim ilə A'lim kimi. Allah göyləri və yeri və ikisi arasında olanları müəyyən etdiyi bir zamana qədər qoruyandır. Buna görə də varlılıqlar yox olub dağılmazlar. ***«Bunları mühafizə etmək Onun üçün heç də çətin deyildir».*** *(əl-Bəqərə 255).* *«(Biz həm də göyü)* ***itaətdən çıxmış hər bir şeytandan qoruduq».*** *(əs-Saffət 7).* Allah qullarını təhlükələrdən, fəlakətlərdən və pis sonlardan qoruduğunu bizə belə xəbər verir. ***«İnsan üçün onu öndən və arxadan təqib edən mələklər vardır».*** *(ər-Rəd 11).* Mələklər Allahın əmri ilə onları qorumaqdadırlar. Onların bütün sözlərini və əməllərini yazmaqdadırlar. Allah insanların niyyətlərini, sirlərini və sinələrində saxladıqlarını da bilməkdədir. Heç bir şey Ona gizli deyildir. Onun üçün gizli sayılan bir şey gizli deyildir. Allah dostlarını günah etməkdən və şeytanın hiylələrinə düşməkdən qoruyar. Bu sayədə Allah dostları şeytanın hiylələrindən və fitnələrindən qurtulurlar. Hər bir müsəlman bütün varlığı qoruyan Uca Allah olduğunu, Onun Hafiz və Həfiz olduğunu bilməlidir.

Allah bütün varlığı qoruyandır. O, bütün hər şeyi toplu və ayrıntılı olaraq biləndir. O, heç bir şeyi unutmaz, səhf etməz və itirməz. O, Quranı hər cür təhrif və

---

[175] Tirmizi 2516, əl-Albani «Səhih əl-Cəmi» 7834-cü hədis.

dəyişikliklərdən qoruyar. Sıxıntı zamanında səni şikayət etməkdən qoruyan. Nemət zamanında da səni fəlakətlərdən qoruyandır. Allahın bütün varlıqları qoruması olmasaydı, varlığı mümkün olan heç bir şeyin varlığı davam etməzdi. Allah bütün varlıqları təkrar yoxluğa dönməkdən qorumuşdur. Göyləri yerə düşməkdən qoruyan və tutan da Odur. Yer üzünü su üzərində yaradan da Odur. Qüdrəti ilə yer üzünü, üzərində yaradıldığı suyun dibinə çökməsini qoymayan Odur. Ancaq Allahın qoruması buna manedir.

## HƏSİB

***əl-Həsib* –** Haqq-hesab tələb edən, heç bir şeyi nəzərdən qaçırmayan deməkdir. ***«Hesab edən olaraq Allah kifayətdir».*** *(ən-Nisa 6).* ***Həsib* –** qiyamət günü qullarını hesaba çəkəcək və sorğu-sual edəndir. Hər bir xeyir Ondan umulur, rəhməti ilə bəla və müsibətləri dəf edəndir. Ehtiyaclar üçün Ona dua edildiyinə görə ehtiyacları qarşılayandır. Hesab çəkən, şahid olan Uca Allahdır. Ömər – *radıyallahu anhu* – deyərdi ki: «Hesaba çəkilmədən əvvəl nəfislərinizi hesaba çəkin. Əməlləriniz çəkilmədən əvvəl sizlər əməllərinizi çəkin və Uca Allahın buyurduğu o, günə hazırlaşın. ***«O, gün siz Rəbbinizin hüzuruna gətiriləcəksiniz. Sizin heç bir sirriniz*** *(Allahdan)* ***gizli qalmayacaqdır».*** *(əl-Həqqa 18).*

## HƏFİ

***əl-Həfi* –** Lütfkar, xoşsifət, bilmək, sevinmək, ***«O, mənə qarşı çox mehriban və lütfkardır*** *(HƏFİ)****».*** *(Məryəm 47).* Əzhəri – *rahmətullahi aleyhi* – deyir ki: «***Həfi* –** bilmək, sevinmək». Suddi – *rahmətullahi aleyhi* – deyir ki: «Dostluq, yoldaşlıq, çox yaxın bir münasibət». Bəzən də Həfi Hakim mənasında da işlədilir. Ərəblər hakimlərə Həfi də deyərdilər. Həmçinin də yaxşılıq edən, hörmət edən, köməyə gəlmək mənasındadır. Dilçi alimlərindən əl-Fərra – *rahmətullahi aleyhi* – deyir ki: ***«O, mənə qarşı çox mehriban və lütfkardır».*** *(Məryəm 47)* ayəsində mən qarşı lütfkar davranan, dua etdiyimdə duamı qəbul edən, ehtiyaclarımı qarşılayan şəkilindədir» deyə açıqlamışdır.

## HƏQQ

***əl-Həqq* –** Haqq, Həqiqət mənasındadır. Qurani kərimdə **285** ayədə keçir. Kəsin olaraq sabit olma, gərəkli olan (sübut, vacib) mənasında işlədilir. ***«Şübhəsiz onların çoxunun üzərinə o, söz*** *(əzab)* ***haqq olmuşdur».*** *(Yasin 7).* Burada Haqq oldu – sabit, vacib oldu deməkdir. ***«O, günahkarlar istəməsə də Allah haqqı sabit və üstün edəcəkdir».*** *(əl-İsra 81).* ***«De ki: «Haqq gəldi. Batil yox oldu».*** *(əl-İsra 81).* Bəzən zülmün əksi olan ədalət: ***«Allah haqq*** *(ədaləti)* ***hökm edər».*** *(əl-Mumin 20).* Bəzən hissə, pay: ***«O, kəslər ki, onların mallarından müəyyən bir haqq*** *(pay)* ***vardır».*** *(əl-Məaric 24).* ***«O, gün onlar Allahın açıq-aşkar haqq olduğunu biləcəklər».*** *(ən-Nur 25).* İbn Abbas – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – gecə namazına durduğu zaman buyurdu: «Ey Allahım! Sənə həmd olsun. Sən göylərin, yerin və ikisi arasında olanların nurusan. Sənə həmd olsun. Sən göyləri, yeri və ikisi arasında olanları tutansan (Qayyumsan). Sənə həmd olsun. Sən göylərin, yerin və ikisi arasında olanların Rəbbisən. Sənə həmd olsun. Sən tək həqiqətsən (Haqsan).

Vədin haqdır, sözün haqdır, səninlə görüşmək haqdır, Cənnət haqdır, Cəhənnəm haqdır, Peyğəmbərlər haqdır, Muhəmməd haqdır, Qiyamət saatı haqdır…» . Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «***Haqq*** **–** inkarı mümkün olmayan, isbat edilməsinə ehtiyac olmayan, varlığı qəbul edilləndir. Buna görə də uca Allahın varlığı qəbul ediləsi şeylərin ilkidir. Varlığı inkar edilməz. Uca Allahın varlığına dəlalət edən dəlillər olmasa da O, vardır. Bununla belə bütün varlıq aləmi Onun varlığının aydın dəlilidir» . Uca Allahın hər sözü və feli haqdır. Onunla görüşmək haqdır. Göndərdiyi Peyğəmbərlər və nazil etdiyi kitablar haqdır. Dini də haqdır. Heç bir şeyi Ona şərik qoşmadan yalnız Ona ibadət etmək də haqdır. ***«Bu belədir. Çünki Allah haqq, müşriklərin ondan başqa ibadət etdikləri*** *(bütlər, tanrılar)* ***isə batildir. Həqiqətən Allah uca və böyükdür».*** *(əl-Həcc 62).* ***«Bu ona görədir ki, Allah haqq,*** *(müşriklərin)* ***ondan qeyri ibadət etdikləri isə batildir».*** *(Loğman 30).* ***«De ki: «Haqq Rəbbinizdəndir».*** *(əl-Kəhf 29).* Allahın bütün isimləri, sifətləri və felləri haqdır. Ona ibadət etmək haqdır. Onun qullarına vədi, əzabı və hesabı da haqdır. Qullar haqqında hökmü ədalətdir və bu hökmündə heç bir haqsızlıq yoxdur.

## HƏKƏM

***əl-Həkəm – «Allah aramızda hökm verənlərin ən xeyirlisidir».*** *(əl-Əraf 87).* ***«Ondan başqasınımı özümə hakim istəməliyəm?».*** *(əl-Ənam 114).* ***«Bəndələrin arasında ixtilafda olduqları məsələlər barəsində Sən hökm edəcəksən!».*** *(əz-Zumər 45).* Bu İsim insanlar haqqında da istifadə edilərək Qurani Kərimdə zikr olunur. ***«****(Ey möminlər!)* ***Əgər ər-arvad arasında ixtilaf olacağından qorxsanız, o zaman kişinin adamlarından bir nəfər və qadının adamlarından da bir nəfər hakim təyin edin».*** *(ən-Nisa 35).* Hani b. Zeyd – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına bir qrup heyət gəldi. Aralarından birinə: «Əbul Həkəm deyildiyində Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – o, kimsəyə: «Həkəm Allahdır. Nə üçün sənə Əbul Həkəm deyirlər?» deyə buyurdu. Adam: «Qövmüm hər hansı bir məsələdə ixtilaf etdiklərində mənim yanıma gəlirlər, mən də həkəmlik edərək aralarında hökm verirəm. Beləcə hər iki tərəf də verdiyim hökmə razı qalırlar» dedi. Peyğəmbər: «Övladların varmı» deyə buyurdu. Adam: «Bəli, Şurayh, Abdullah və Müslim Bəni Hani» dedi. Peyğəmbər: «Ən böyüyü hansıdır?» deyə buyurdu. Adam: «Şureyh» dedi. Peyğəmbər: «Artıq sən Əbu Şureyhsən» deyə buyurdu . Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «***Həkəm*** **–** hököm və qərar verəndir». İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Hökmlər üç cürdür. 1) Dini hökmlər. 2) Varlıq aləmi ilə bağlı hökmlər. 3) Qədəri kovni hökmlər.

Hər müsəlman Allahdan başqa Həkəm olmadığını, Onun bütün fellərinin hökm, bütün sözlərinin hikmət və vəsiyyətlər olduğunu, Peyğəmbərlərin hikmət qaynağı və hikmət əhli kimsələr olduğunu bilməlidir. İnsanlar hökm verirkən Allahın nazil etdiyi ilə hökm verməlrəi lazımdır. Hər müsəlman Allahın hökmü ilə hökm edilən bir məhkəməyə çağırıldığı zaman bu çağrışa cavab verməli və əleyhinə bir hökm çıxdığı zaman buna uymaq məcburuyyətindədir. Əks halda zülm edənlərdən olar. ***«Aralarında hökm etmək üçün Allahın və Peyğəmbərinin yanına çağrıldıqda onlardan bir dəstə***

---

[176] Buxari 3/2-4, Müslim 769.
[177] Beyhəqi «Əsmə vəs Sifət» s. 12,13.
[178] Buxari 811, Əbu Davud "Kitabul Ədəb" 4955, Nəsəi 5389, əl-Albani "Mişkət" 4766, "İrva" 2615.

***dərhal üz çevirər. Əgər haqq onların tərəfində olsa, itaət edib** (tez) **onun yanına gələrlər. Onların qəlblərində xəstəlikmi vardır? Yaxud Allahın və Peyğəmbərinin onlara cövr, haqsızlıq edəcəklərindən qorxurlar? Xeyr, onlar özləri zülmkardırlar».*** *(ən-Nur 48-50).* Hakim və rəhbərlər Allahın cızdığı sərhədlərdən kənara çıxmamalı və qoyduğu qadağaları aşmamalıdırlar. İnsanlar arasında adil davranmalı, kimsəyə ayrı-seçkilik etməməlidirlər. Əleyhlərinə belə olsa doğruluqdan qaçmamalıdırlar və haqq ilə hökm verməlidirlər. ***«Ey iman gətirənlər! Sizin özünüzün. Ata-ananızın. Yaxud qohumlarınızın əleyhinə belə olsa, ədalətdən möhkəm yapışın Allah şahidi olun».*** *(ən-Nisa 135). «(Ya Davud!)* ***Biz səni yer üzündə xəlifə etdik. Buna görə də insanlar arasında ədalətlə hökm et, nəfsdən gələn istəklərə uyma, yoxsa onlar səni Allah yolundan sapdırarlar. Şübhəsiz ki, Allah yolundan sapanları haqq-hesab gününü unutduqları üçün şiddətli bir əzab gözləyir».*** *(Sad 26).*

# HƏKİM

***əl-Həkim** – **«O, Həkimdir».** (əz-Zariyət 30). **«Allah biləndir, Həkimdir».** (ən-Nisa 26).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına bir bədəvi gələrək dedi: «Mənə daima söyləyəcəyim bir neçə kəlimə öyrət». Peyğəmbər: «De ki: Allahdan başqa ibadətə layiq haqq İlah yoxdur, Allah böyüklərin ən böyüyüdür. Ona həmd olsun. Aləmlərin Rəbbi olan Allah Ucadır. Əziz və Həkim olan Allahdan başqa heç bir qüc və qüvvət sahibi yoxdur…» deyə buyurdu . Uca Allahın yaratmış olduğu hər bir şey elmdən və hikmətdən meydana gəlmişdir. Hökmü elmdən və hikmətindən qaynaqlanmasıdır. Hökm və Hikmət sahibi. Hər bir şeyi gözəl və faydalı şəkildə yaradan və yaratdığını yerli-yerinə qoyandır. Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «Həkim söylədiyi hər söz və etdiyi hər bir felin doğru olandır. Belə bir sifət yalnız Allaha yaraşır. Çünki etdiyi bütün fellər doğrudur, əsərləri mükəmməldir və heç bir qüsuru yoxdur. Bu qədər doğru, sağlam və mükəmməl əsərlər ancaq hakim olan biri tərəfindən edilə bilər. Bu əsərlərin həyat sahibi Hakim olan Allahdır». Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «Həkim hər bir şeyi sağlam və nöqsansız yaradandır. ***«O, yaratdığı hər şeyi gözəl yaradandır».*** *(əs-Səcdə 7)».*

Hikmət bir şeyi edənin onu nə üçün etdiyi ilə əlaqədardır. Yəni hikmət edənin etmə məqsədi ilə əlaqəli bir qavramdır. Dolayısı ilə bir məqsəd üçün etməyən kimsə haqqında hikmət düşünülməz. Hikmət bir kimsənin elmə və saleh əmələ yönəlməsini və istədiyi məqsədi əldə etməsini bildirir. Hikməti qəbul etməyən Allaha tam şəkildə həmd edə bilməz. Onu nöqsanlardan münəzzəh tutmaz.

# HƏLİM

***əl-Həlim*** – Səbirli və təmkinli. Cəzalandırmağa gücü çatdığı halda həmən cəzalandırmayan, qullarının üsyanlarına qarşı həmən qəzəbə dalmayan deməkdir. ***«Allah bağışlayan və həlimdir».*** *(əl-Maidə 101).* İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyi ki: «Allah həlimdir. Etdiyi günahdan ötrü tövbə etməsi üçün qulunu cəzalandırmada tələsməyəndir». Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «***Həlim*** - günahları bağışlayan, cəzalandırmağa tələsməyən. Bu İsmi gücü olduğu halda

[179] Müslim 2697.
[180] ***Hikmət*** – Lazım olan feli, lazım olan formada, vaxtda etməyə deyilir.

bağışlayana verilir, gücü olmadan bağışlayana bu İsim verilməz». ***«Əgər Allah insanları etdikləri günahlara görə cəzalandırsaydı yer üzündə bir nəfəri də belə*** *(sağ)* ***qoymaz. Lakin Allah onları müəyyən bir vaxta qədər gecikdirir».*** *(Fatir 45).* ***«Əgər Allah insanları günahlarına, haqsızlıqlarına görə cəzalandırsaydı, yer üzündə bir canlını da sağ qoymazdı. Lakin Allah onlara müəyyən müddət möhlət verir».*** *(ən-Nəhl 61).* Qurani Kərimdə 15 yerdə keçməkdədir. Bunlardan **11**-də Allaha, **2**-də İbrahimə, **1**-də Şueybə, **1**-də İsmailə izafə edilmişdir. Bu İsim Qurani Kərimdə tək işlədilməyərək bütün günahları bağışlayan ***Gafur***, haqqı ilə bilən ***Alim***, hər şeydən mustəğni olan, hər şeyin Ona möhtac olduğu varlıq ***Ganiyy***, az yaxşılığa çox mükafat verən ***Şəkur*** ilə birlikdə işlədilmişdir. ***«Şübhəsiz Allah biləndir Həlimdir».*** *(əl-Həcc 59).* ***«Və bilin ki, şübhəsiz ki, Allah bağışlayandır,*** *(qullara)* ***yumşaq davranandır».*** *(əl-Bəqərə 235).* Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «Günahları səbəbilə qullarına nemət verməyi və yaxşılıq etməyi kəsməyəndir. O, ona itaət edəni ruziləndirdiyi kimi, Ona üsyan edəni də ruziləndirir. Ondan qorxan və yaxşılıq edənlərə nemət verməyə davam etdiyi kimi, günah etməyə davam edən qullarına da nemət verməyə davam edər. Bəla və müsibətlərdən qoruması üçün Ona dua edəni və ya ibadət ilə məşğul olub bu istəkdə olmayanı qoruduğu kimi, dua etməyib və Ondan qafil olan kimsələri də bəla və müslibətlərdən qoruyar» .

# HƏMİD

***əl-Həmid – «Heç şübhəsiz ki, Allah Ğani*** *(heç kimsəyə və heç bir şeyə möhtac olmayandır)**, Həmid*** *(həmd də yalnız Onadır)***».*** *(Liğman 26).* Qurani Kərimdə **61** yerdə Allaha nisbət edilərək zikr edilmişdir. Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «***Həmid*** – edilməyə haqq edən, həmdə layiq olandır. Çünki O, vardı və bütün varlıqları və insanı yoxdan var etdi. Sonra iki üstün neməti ağıl və həyatı insanda topladı. Sonra ona saysız nemətlər verdi və onu bütün varlıqlara üstün etdi. O, halda Ondan başqa kim həmd edilməyə daha layiqdir? Kim Onun qədər həmdə layiq olur? Xeyr, bütün təriflər və həmdlər sadəcə Onadır, başqasına deyildir». Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «O, felləri ilə həmd edilməyi haqq edən və həmdə layiq olandır. Həmd zatla əlaqədar işləndikdə isə – fail vəznində olub məful – yəni ***Mahmud*** – təriflənən, həmd edilən mənasında olur. Sıxıntı və bolluq, şiddət və rahatlıq anlarında yalnız Ona həmd edilir. Çünki O, Hakimdir. Hər bir şeyi yerli yerində edər. Heç bir xəta və səhf etməz. O, hər bir vəziyyətdə həmd edilməyi haqq edəndir. Hər insan Allahı həmd etmədiyi kimi Allah da hər insanı həmd əhli etməz. Allahın qəzəbini qazanmış insanlar Ona həmd etməkdən uzaqdırlar. Allah belə insanları həmd əhli etməz. Lakin bu insanlar qiyamət günü qəbrlərindən qaldırıldıqları zaman istəməsələrdə belə Allaha həmd edəcəklər. ***«O, gün ki, Allah sizi çağıracaqdır. Siz də Ona şükr edərək dərhal çağırışına cavab verəcəksiniz və sizə elə gələcəkdir ki,*** *(dünyada)* ***çox az qaldınız».*** *(əl-İsra 52).* Heç kimsə Ona həmd etməsə də belə O, yenə də həmdə layiq olandır. ***Həmd*** – təriflənəni və həmd ediləni sevməyi əhatə edir. Onu sevən, lakin Onu tərif etməyən Ona həmd etmiş olmaz. Onu sevmədikcə və Onu tərif etmədikcə Ona həmd etmiş olmaz. Bu sifətlər nə qədər çox olacaqsa göstəriləcək sevgi və tərif də bir o, qədər çox və böyük olar. Allah heç bir tərəfdən heç bir nöqsanlığı olmayan mütləq kamillik sahibidir. Bütün yaxşılıqlar və ehsanlar Ondan gəlir və Ona da dönərlər. Bu

---
[181] Beyhəqi «Əsməu vəs Sifət» 53.

üzdən O, hər yöndən həmd edilməyə, sevilməyə və tariflənməyə layıqdır. O, zatı, sifətləri, isimləri və felləri üçün sevilməyə və tərif olunmağa tək varlıqdır. Ondan qaynaqlanan hər bir şey gözəldir. Və hər yaxşılıq üçün Ona həmd edilməlidir.

Bütün göylər, yer, ikisi arasında olanlar və bunlardan var olanlar Allaha həmdlə dolmuşdur. Allahın həmdi dünyanı və axirəti, bütün aləmləri doldurmuşdur. Bütün varlıqlar nöqsansız bir şəkildə Ona həmd edərlər. Sonunda Ona həmd edilməyən bir hökm yoxdur. Göylər və yer Ona həmd ilə dururlar, Cənnət əhli Cənnətə, Cəhənnəm əhli də Cəhənnəmə Ona həmd edərək girirlər. Həsənul Bəsri – *rahmətullahi aleyhi* – deyir ki: «Cəhənnəm əhli Allaha həmd edərək Cəhənnəmə girirlər». Allah bütün aləmlərin Rəbbi olması ilə öyünür və yalnız onun həmdə layiq olduğunu bizə bildirir: ***«Həmd Aləmlərin Rəbbi olan Allahadır».*** *(əl-Fatihə 2).* Allah kitabları göndərməklə öyünür: ***«Həmd olsun o, Allaha ki, Quranı heç bir əyriliyə yol vermədən öz bəndəsinə nazil etdi!».*** *(əl-Kəhf 1).* Allah göyləri və yerləri yaratmaqla öyünür: ***«Həmd göyləri və yerləri yaradan, qaranlıqları və nuru yaradan Allahadır».*** *(əl-Ənam 1).* Allah hər bir şeyin sahibi olmaqla və mülkünün qüsursuz olduğu ilə öyünür: ***«Göylərdə və yerlərdə nə varsa hamısının sahibi olan Allaha həmd olsun».*** *(əs-Səba 1).* Onun həmdi bütün zaman və məkanı doldurmuş, bütün əşyaları və sözləri əhatə etmişdir: ***«Elə isə axşam-səhər Allahı təqdis edib şəninə təriflər deyin! Göylərdə və yerdə həmd yalnız Ona məxsusdur. Gün batanda da, gündüz də Onu təqdis edib şəninə təriflər deyin».*** *(ər-Rum 17,18).* Bütün varlıqlar necə Ona həmd etməsinlər ki? ***«O, yaratdığı hər şeyi ən gözəl yaradandır».*** *(əs-Səcdə 7).* Ona necə həmd etməsinlər ki, Onun əmri ilə var olmuşlar: ***«Dağlara baxıb onları donmuş zənn edirsən, halbuki onlar bulud keçdiyi kimi keçib gedərlər. Bu hər şeyi bacarıqla, yerli-yerində edən Allahın gördüyü işdir».*** *(ən-Nəml 88).* Varlıq aləmindəki ən kiçik parçalar belə Ona həmd edir və həmd edilməsinə şahidlik edərlər: ***«Yeddi göy, yer və onlarda olan bütün məxluqat Allahı təqdis edir. Elə bir şey yoxdur ki, Allaha tərif deyib ona şükr etməsin, lakin siz onların*** *(dillərini bilmədiyiniz üçün)* ***təqdisini anlamazsınız. Allah həqiqətən həlim və bağışlayandır».*** *(əl-İsra 44).* Allahın bütün felləri hikmət, mərhəmət və faydalarla doludur. Onun hər bir feli ədalətdir və gözəldir. Qadağan etdiyi hər bir şey isə pisdir. Bütün varlıq Onundur. Bütün yaxşılıqlar Onun əlindədir. Bütün işlər sonda Ona qayıdacaqdır. Hər şey Ona doğru axmaqdadır. O, bu İsim və Sifətlərilə həmd edilir, övülür və mədh edilir. Allah ən gözəl və mükəmməl sifətlərə sahibdir. Heç bir nöqsanlığı və qüsuru yoxdur. Onun sahib olduğu bu sifətlərin hər biri ən mükəmməl şəkildə həmdə layiqdir. Zatında, sifətlərində, isimlərində və fellərində Ona həmd olunsun. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Ey Rəbbimiz! Göylər, yer və hər ikisi arası qədər və bunlardan başqa sənin dilədiyin qədər Sənə həmd olsun» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Ən gözəl zikr ***Lə İləhə İlləllah***, ən gözəl dua isə Əlhəmdulilləh» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Rukudan qalxarkən: «***Rabbənə Və Ləkəl Həmd*** – Rəbbimiz! Həmd yalnız Sənədir» .

Allahın bütün İsimləri gözəldir, pis olanı yoxdur. Onun bütün Sifətləri ən mükəmməl və ən üstündür, heç bir nöqsanlıq və qüsur yoxdur. Bütün fellərində hikmət vardır, hikmətsiz və faydasız heç bir feli yoxdur. Göylərdə və yerdəki ən gözəl

---

[182] Müslim 476.
[183] Nəsai 837.
[184] Buxari «Azan» 74,82, Müslim 414.

örnəklər Ona aiddir. O, üstün və hikmət sahibidir. Nəyi, harada, necə edəcəyini ən gözəl bilən Odur. Heç bir bənzəri yoxdur. Kamillik Sifətlərinin ziddi yoxdur. Həyatın ziddi olan ölüm Onda yoxdur. Qayyumun ziddi olan qəflət, yanılma, yatmaq, mürgü Onda əsla yoxdur. Allah elm sahibidir. Bunun zidd olan, unutma və buna bənzər şeylər Onda yoxdur. O, tam güc və qüdrət sahibidir. Ziddi olan acizlik, yorğunluq, taqətsizlik Onda yoxdur. O, kəsinliklə heç kəsə möhtac deyildir. Gücsüzlük, yaradılma və cansızlıq Onun haqqında mümkün olmadığı kimi Onun öyülməməsi və həmd edilməməsi də mümkün deyildir. Bütün həmd və təriflər onadır. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şeytan sizlərdən birinin yanına gələrək ona belə vəsvəsə verə bilər: «Bu şeyi kim yaradıb? «Filan şeyi kim yaradıb?», sonda isə: «Bəs onda Allahı kim yaradıb?» deyər. Əgər vəsvəsələr bu həddə çatsa qoy o, kimsə Allaha sığınsın» .

## HƏYY – QAYYUM

***əl-Həyy*** **–** Hər yönüylə tam bir həyata sahib olan deməkdir. İbn Abbas - *radıyallahu anhu* – deyir ki: «***Həyy*** **–** gücünü itirməyən və yox olmayan deməkdir». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «***Yə Həyyu, Yə Qayyumu Birahmətikə Əstəğisu Əslih Li Şəni Kulləhu Vələ Təkilni İlə Nəfsi Tarfətə Ayn*** **-** Ya Həyyu! Ya Qayyumu! Rəhmətinlə yardım diləyirəm. Bütün işlərimi islah et və məni bir göz qırpımı belə öz ixtiyarıma buraxma» . İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dua edərkən buyurdu: «…Sən əsla ölməyən və daima diri olansan» .

***əl-Qayyum*** **–** Ölməz, daima mövcud olan, heç bir şeyə möhtac olmayan, hər bir şeyin Ona möhtac olması mənasındadır. Qurani Kərimdə **3** ayədə Həyy İsmi ilə zikr edilmişdir. ***«Allah, Ondan başqa İlah yoxdur. Diridir*** *(Həyy)*, ***ölməzdir*** *(Qayyum-dur)****».*** *(əl-Bəqərə 255).* ***«Sən əsla ölməyən və daima diri olan*** *(Allaha)* ***təvəkkül et və Onu həmd ilə təsbih et».*** *(əl-Furqan 58).* Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «***Qayyum*** **–** sonu olmayan və varlığı daim olandır».

## HƏYİYYU

***əl-Həyiyyu*** **-** Allah özünü həya sifəti ilə vəsf etdiyi kimi, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – də Onu bu sifətlə vəsf etmişdir. Buna görə də O, Həya və Kərəm sahibidir. Salman Farisi – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Əbədi və Kərim olan Rəbbimiz əllərini ona tərəf qaldıran qulunun əllərini geri boş qaytarmaqdan Həya edir» . Ummu Süleym – *radıyallahu anhə* – deyir ki: «Allah haqqı bəyan etməkdən həya etməz» . Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Allah həya sahibidir və ayıbları örtəndir. Biriniz yuyunduğu zaman örtünsün» . Hər müsəlman onu yaradan Rəbbindən utanmalı və həya etməlidir. Belə ki, Rəbbi onu qadağan etdiyi yerlərdə görməməli, əmr etdiyi

---

[185] Buxari 3276.
[186] "Səhihul Tərğib vət Tərhib" 1/273.
[187] Buxari.
[188] Əbu Davud 1488, Tirmizi 3551, İbn Məcə 3865. Musnəd 5/438, əl-Albani "Səhih Tirmizi" 3/179.
[189] Buxari 6091, Müslim 313.
[190] Əbu Davud 4012.

yerlərdə görməlidir. Rəbbindən həya edərək çirkin söz və davranışlardan çəkinməlidir. Allahdan çox həya edən kimsə Ona üsyan etməkdən də çəkinər. Çünki Allahın hər yerdə onunla birlikdə olduğunu bilər. Qulun söz və əməldə olan günahları insanlar arasında nə qədər çox yayılarsa, günahın açığa çıxması da o, qədər böyük olar. İnsanlardan utanmayan Allahdan da utanmaz. Kim utanmırsa istədiyini edə bilər və onun bu günahları tərk etməsinə mane olan həyadır. Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Həqiqətən də insanların Peyğəmbərlikdən öyrəndikləri ilk söz: «Əgər həya etmirsənsə istədiyini et» . Həya qəlbin maddəsidir, hər bir xeyirin əslidir və onun getməsi bütün xeyirdən məhrum olmaq deməkdir. Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Həyanın hamısı xeyirdir» . Əgər həya yoxdursa onu bu günahlardan çəkindirən maneə də yoxdur. Əgər Allahdan utanmırsa istədiyi əməli edə bilər. Günahlar həqiqətən də qəlbi zəiflədir. Günahı edən şəxs bu günahı etməsindən xəbərdar olmasına baxmayaraq yenə də buna əhəmiyyət vermir. Çünki bunu etməyə onu vadar edən qəlbdə həyanın olmamasıdır. Həya insanlarda öyülən bir əxlaqdır. Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Həya imandandır» . ***Həya*** – həyat sözündən götrülmüşdür. Kimin həyası yoxdursa o, dünyada meyyid, axirətdə isə bədbəxt olar və kim də günah etdiyi zaman Allahdan utanmazsa, Allah da Qiyamət günü onu cəzalandırmaqdan utanmaz. ***«Onlar insanlardan gizlətsələr də Allahdan gizlədə bilməzlər».*** *(ən-Nisa 108)* ayəsində insanlardan utanaraq gizlənən, lakin insanları yaradandan utanmayanları pisləmişdir. Çünki belə etməklə onlar yaradılanları yaradandan üstün tutmaqdadırlar.

## XALİQ – XALLƏQ

***əl-Xaliq – «Allahdan başqa bir yaradıcımı*** *(XALİQ)* ***var».*** *(Fatir 3).* ***«O, hər şeyin yaradıcısıdır*** *(XALİQ)****, elə isə ona qulluq edin».*** *(əl-Ənam 102).* Allah yaradandır, Ondan başqa hər bir şey yaradılandır. Hər şey Onun əmrində və xidmətindədir. Ondan başqa bir yaradıcı yoxdur. Bütün hər şeyi göyləri, yeri, ikisi arasında və içində olanları, bunların hərəkətlərini, ruzilərini, əcəllərini, sözlərini və fellərini də yaradmışdır. Bütün bunların tək yaradıcısı Allahdır. Bütün varlılıqlar sonradan yaradılmış və yoxdan var edilmişdir. Hər şey Ondan başladı və yenə də Onda son olacaqdır.

***əl-Xalləq – «Göyləri və yeri yaradan onlar kimisini yaratmağa qadir deyilmi? Əlbəttə qadirdir.*** *(Hər şeyi)* ***yaradan*** *(XALLƏQ)* ***və*** *(hər şeyi)* ***bilən*** *(ALİM)* ***Odur».*** *(Yasin 81).* ***«Həqiqətən Rəbbin*** *(hər şeyi)* ***yaradan*** *(XALLƏQ)* ***və biləndir».*** *(əl-Hicr 86).* ***«And olsun onlardan: "Onları kim yaratdı" deyə soruşsan, onlar mütləq: "Allah" deyə cavab verəcəklər».*** *(əz-Zuxruf 87).* Madəm ki, Allah bütün varlılıqları tək yaratdısa, o halda ibadətə və qulluq edilməyə layiq olan tək varlıq da Odur. Bu həqiqət olduğu halda və Onun tək yaradıcı olduğu qəbul edilərkən, ibadət etməkdə Ona nəyə görə şərik qoşulur? Quranın Rububiyyət tövhidini və Uluhiyyət tövhidini isbat etmək üsulu belədir. Digər bir ayədə isə: ***«Sizi və sizdən əvvəlkiləri yaradan».*** *(əl-Bəqərə 21).* Burada Allah bizi və bizdən əvvəlkiləri, atalarımızı, babalarımızı və s. yaratdığını diqqətə çəkməkdədir, beləcə tək yaradıcı olduğunu, nə bizim nə də bizdən əvvəlkilərin yaradılışında kimsənin ona şərik olmadığını bildirməkdədir. Allahın varlılıqları tək

[191] Buxari.
[192] Müslim.
[193] Buxari, Müslim.

yaratması Onun güc və qüdrətinin, iradəsinin, elminin, hikmətinin və həyatının mükəmməl və nöqsansız olmasına dəlalət edər. Bu sifətlərin və fellərin bənzərsiz olduğuna və heç bir varlıqda olmadığına, heç bir varlığın əməllərində Ona şərik olmadığını göstərir. Bu cümlə ilə Allah varlığını isbat etdikdən sonra onların yaradılışlarının qayəsini belə açıqlayır: ***«Rəbbinizə ibadət edin».*** *(əl-Bəqərə 21).* ***«Göyləri və yeri yaradan, göydən yağmur endirən, o yağmurla sizin üçün ruzi olaraq cürbəcür meyvələr yetişdirən. Əmri ilə dənizdə üzmək üçün gəmiləri sizə tabe və çayları sizə ram edən Allahdır. Seyr edən Günəşi və Ayı, həmçinin gecəni və gündüzü sizin ixtiyarınıza verən Odur».*** *(İbrahim 32,33).* ***«****(Bütlər yaxşıdır)* ***yoxsa göyləri və yeri yaradan, sizin üçün göydən yağmur endirən kəs? Sonra biz o, yağmurla sizin üçün gözəl bağçalar yetişdirdik. Siz o, bağçaların ağaclarını göyərdə bilməzdiniz. Məgər Allahla yanaşı başqa bir tanrımı var? Lakin müşriklər tay tutan bir tayfadırlar!*** *(Bütlər yaxşıdır)* ***yoxsa yeri məskən yaradıb ortasından çaylar axıdan, üzərində möhkəm durmuş dağlar bərqərar edən və iki dənizin arasında maneə qoyan kəs? Məgər Allahla yanaşı başqa tanrımı var? Lakin müşriklərin əksəriyyəti bilmirlər».*** *(ən-Nəml 60-61).* ***«Elə isə bütün bunları bilə-bilə Allaha şərik qoşmayın».*** *(əl-Bəqərə 22).*

## XABİR

***əl-Xabir –*** Xabir – hər şeydən xəbərdar olan. Hər bir şeyin zahirini bildiyi kimi içini və gizliliklərini də bilməkdədir. Qəlblər və sinələr hər şeyi incə detallarıynan bilən Lətif və Xabir olan Allahdan bir şeyi necə gizlədə bilər? ***«O, Hikmət və Bilik*** *(XABİR)* ***sahibidir».*** *(əl-Ənam 18).* ***«O, yaratdığını bilməzmi? O, Lətifdir, Xabirdir».*** *(əl-Mulk 14).* ***«Bunu mənə bilən və Xabir olan Allah xəbər verdi».*** *(ət-Təhrim 3).* Allah hər şeydən xəbərdar olan Xabirdir. O, hər şeyi yerli-yerinə qoyan və layiq olduğu yerə endirən Həkimdir. O, heç bir şeyi uyğun olmayan bir yerə qoymaz, layiq olmadığı bir yerə endirməz. O, bütün bunları qüsursuz elmi və hikməti ilə edər. Allah savab yerinə cəza, cəza yerinə də savab verməz. Ucaltdığı yerdə alçaltmaz, alçaltdığı yerdə isə ucaltmaz. İzzət yerinə zillət, zillət yerinə isə izzət verməz. Qadağan edilləni əmr etməz, əmr ediləni isə qadağan etməz. O, harada nə edəcəyini və risalətini kimə verəcəyini, kimin buna layiq olduğunu ən yaxşı biləndir. Bu risalətə kimin layiq olmadığını da çox gözəl biləndir. Allah neməti haqq etməyənə deyil, haqq edənə verir.

## RAFİ’

***ər-Rafi’ – “Dərəcələri yüksəldən*** *(mələklərin, peyğəmbərlərin, övliyaların və möminlərin mərtəbələrini ucaldan, yaxud hər şeydən uca)****, ərşin sahibi Allah öz əmrindən olan vəhyi bəndələrindən istədiyinə nazil edir ki,*** *(o, insanları)* ***görüş günü*** *(yer və göy əhlinin, ibadət edənlə ibadət olunanın, zalımla məzlumun bir-birilə görüşəcəyi, ruhla bədənin qovuşacağı qiyamət günü)* ***ilə qorxutsun!”.*** *(əl-Mumin 15).* ***Rafi’ –*** ondan yüksək olmayan deməkdir. Allah ən yüksəkdir. O, tərif və sənanın bütün dərəcələrini haqq edən varlıqdır. Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «***Rafi’ –*** Allahın zatı sifətlərindəndir. Həmd və sənanın bütün dərəcələrini haqq edəndir. Yüksək üstünlüyə sahib deməkdir».

# RAHMƏN – RAHİM

***ər-Rahmən*** – Allahın gözəl isimlərindən və sifətlərindəndir. Ehsan, bağışlama, rəhmətin ən uca dərəcəsi ilə muttasıf olan deməkdir. Ruzisini, ehtiyacları və hər cür yaxşılıqları ehsan xüsusunda rahmətini məxluqatından heç əsirgəməyən mənasında olan Rahmən, Rahim İsmindən daha geniş mənanı ifadə edər. Quranın ilk ayəsi olan Bismilləhdəki Rahmən və Rahim isimləri arasında fərq Allah dünyanın Rahməni və axirətin Rəhimidir. Rahmən sifəti Allahın dünyada canlılara, mömin və kafirlərə ayrılıq etmədən bütün insanlara şəfqət və mərhəmətlə davranmağı öz Zatına fərz qılmışdır. Quranda insanlar üçün işlədilən Rahmən İsmi **57** yerdə işlədilmişdir. Bu İsimlə başlayan ər-Rahmən surəsi də vardır. Bu surədə Allah insanlar, cinlər və heyvanlar üçün rahmət olaraq yaratdığı nemətləri saymaqda, insanların və cinlərin bu nemətlərin qiymətini bilib nankorluq etməmələrini dəfələrlə vurğulamışdır. Bu da Rahmən İsminin təcəllisidir . ***«Mərhəmətim hər şeyi ehtiva etmişdir».*** *(əl-Əraf 125).* Bu da bilinməlidir ki, keçilmiş qəzəb yavaş da olsa mutləq onu haqq edənlərə yetişəcəkdir. ***«Onlara: «Rahmənə səcdə edin» deyildiyi zaman, onlar: «Rahmən nədir? Bizə əmr etdiyin şeyə səcdəmi edəcəyik?» deyə cavab verərlər».*** *(əl-Furqan 60). «(Ya Muhəmməd!)* ***De ki: «İstər Allah, istərsə də Rahmən deyib çağırın*** *(dua edin),* ***hansını desəniz*** *(fərqi yoxdur),* ***çünki ən gözəl adlar yalnız Onundur».*** *(əl-İsra 110).* Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – öz Rəbbindən buyurdu: «Mən namazı Özümlə, qulum arasında böldüm. Qul: «Həmd yalnız aləmlərin Rəbbi Allaha aiddir» dedikdə. Mən: «Qulum mənə həmd etdi». Qul: «O, Rahməndir, Rahimdir» dedikdə mən: «Qulum Məni tərif etdi» deyə buyururam . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şübhəsiz ki, acıma, mərhəmət hissi Rahməndən bir paydır» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah insanlardan ancaq mərhəmətli olanları bağışlar» . Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in hüzuruna bir qrup əsirlər gətrildi. Bunların içərisində uşağını itirmiş bir qadın təşviş içində uşağını axtarırdı. Qadın əsirlər arasında uşağını tapdıqda həmən onu bağrına basaraq əmizdirməyə başladı. Peyğəmbər: «Bu qadın öz uşağını heç oda atarmı?» deyə buyurdu. Səhabələr: «Xeyr, atmaz» dedilər. Peyğəmbər: «Heç şübhəsiz ki, Uca Allah öz qullarına bu qadının öz uşağına göstərdiyi şəfqətdən də daha mərhəmətlidir» .

***ər-Rahim*** – Çox Mərhəmətli, mərhəmət olunan, bağışlamaq deməkdir. ***Ruhm, Ruhama*** – mərhəmət, yaxşılıq və nemət mənasında da gəlir. Mərhəməti bol olan. Qurani Kərimin **115** ayəsində Allahın Ğafur ismi ilə birlikdə işlədilmişdir. Dörd ayədə ***Ərhamur Rahimin*** – mərhəmətlilərin ən mərhəmətlisi olaraq işlədilmişdir. Rahim İsminin təcəlliləri isə daha çox axirətdə görüləcəkdir. Allahın oradakı ikram və ehsanları möminlər üçün olacaqdır. Bir çox ayədə Rahim ismi zikr edilərək Allah möminləri bu Sifətlə bağışlayacağını bilinmişdir .

---

[194] Bax: Fatihə 1,2, Fussilət 2, İsra 110.
[195] Müslim 395.
[196] Buxari «Ədəb» 13.
[197] Buxari «Cənaiz» 32, Müslim «Cənaiz» 9,11.
[198] Müslim 2754.
[199] Bax: Nisa 16, Furqan 68-71, Əhzab 43, Fəth 14.

## RAQİB

***ər-Raqib –*** Könüllərdə gizlənən şeyləri bilən, hər kəsin etdiyini görüb nəzarət edən, yaratdıqlarından bir an belə qafil olmadığını və onların işlərinə heç bir zaman qayğısız qalmadığını ifadə edər. ***«O, Allahın görməkdə olduğunu bilmirmi?».*** *(əl-Ələq 14).* Bütün bunlardan xəbərdar olan insan nəfəs alıb-verməsini belə Allah üçün olmasına diqqət edər. Özü Allahı görmədiyi halda Allahın onu gördüyünü bilən kimsənin daima bu düşüncə və etiqad üzərə olması və Allaha qarşı çıxmaqdan çəkinməsi lazımdır. Bu İsim Qurani Kərimin **3** yerində keçməkdədir. ***«Heç şübhəsiz ki, Allah sizin üzərinizdə Raqibdir».*** *(ən-Nisa 1).* ***«…Sən canımı aldıqdan sonra onlara nəzarətçi Özün oldun».*** *(əl-Maidə 117).* Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «***Raqib –*** yaratdığı şeylərdən qafil olmayandır. Onun yaratdıqlarından qafil olması, əskik olduğunu və qəflətdə olduğu nöqtədən ona zərər gələbiləcəyini göstərir. Bu isə Allah haqqında imkansızdır».

## RAUF

***ər-Rauf – «Sənin Rəbbin şəfqətli*** *(RAUF)* ***və mərhəmətlidir*** *(RAHİM)*». *(ən-Nəhl 7).* Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «***Rauf –*** qullarına acıyan, onlara asanlıq istəyən deməkdir. Uca Allah qullarına qaldıramayacaqları ibadətlər və yüklər ilə yükləməmişdir. Xəstəlik, qocalıq və zəiflik kimi hallarda onlara bir çox ibadətləri asanlaşdırmışdır. Hətta edə biləcəkləri bir çox şeyləri onlara yükləməmişdir. Allah şəfqət və mərhəmət sahibidir». Hər müsəlman Allahdan başqa mütləq şəfqət sahibi olmadığını, onun şəfqətinin biz insanların şəfqəti kimi olmadığını bilməlidir. Allahın qullarına bol nemətlər verməsi, onları cürbəcür təhlükələrdən qoruması Onun qullarına olan şəfqəti və mərhəmətidir. Bəzən də müsibət verərək onları içində olduqları qəflətdən ayıltması da Onun şəfqət və mərhəmətidir. Bu bəla və müsibətlər kənardan belə görünə bilər, lakin bunlar onlar üçün bir şəfqət və mərhəmətdir. Bu üzdən insanın başına bir müsibət gəldikdə: «Allah bu müsibətlə ona mərhəmət etdi» deyə deyilir. Allahın bu ismini bilən kimsə Allahın ona şəfqət və mərhəmət etdiyi kimi o, da nəfsinə acımalı, ona gücündən artığını yükləməməlidir. Nəfsə acımaq nə deməkdir? Allahın əmrlərini yerinə yetirmək, qadağalarından çəkinmək və təhlükələrdən onu qorumaq. Nəfsinə acıyıb şəfqət göstərdiyin kimi başqa insanlara da acımalı və onlara da şəfqət əlini uzatmalısan. Beləcə də şəfqətli bir qəlbə sahib olur və hər iki dünyada da Allahın şəfqət və mərhəmətinin səni əhatə etməsinə nail olmuş olursan.

## RAFİQ

***ər-Rafiq –*** İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «O, Allah Rafiqdir. Rifq əhlini (yumşaq davranan kimsələri) sevir. AbdurRahmən əs-Sədi – *rahmətullahi aleyhi* – deyir ki: «Uca Allahın İsimlərindən biri də Rafiqdir. Rafiq kəliməsi ***Rifq*** – yumşaq davranmaq, incə davranmaq kökündən gəlməkdədir. Rifq işlərdə tələsməyən və yavaş-yavaş davranmaq deməkdir. Sərtliyin ziddidir. Sərtlik isə sərt davranmaq və tələsmək mənasındadır. Bu İsim Qurani Kərimdə keçməməkdədir. Bu İsim səhih hədislərdə zikr olunmuşdur. Allah qullarına qarşı son dərəcə mərhəmətli və lütfkardır. Qullarının da bir-birilərinə qarşı incə və yumşaq davranmalarını, sərtlikdən qaçınmalarını, xoş könülüklə hərəkət etmələrini istər. Rifq ilə hərəkət etmək insanları mehribançılığa, dostluğa gətirir. Aralarında olan düşmənçiliklər yox olur. Peyğəmbər – *sallallahu*

*aleyhi və səlləm* – buyurdu: «Yumşaqlıqdan məhrum olan, xeyirdən məhrum olur» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Aişə - *radıyallahu anhə* – yə buyurdu: «Ya Aişə! Şübhəsiz ki, Allah Rafiqdir (qullarına qarşı lütfkardır). Rifqi (sözdə, işdə yumşaq olmağı) sevər. Şiddətə (sərtliyə) qarşı vermədiyi (hətta) ondan başqalarına da vermədiyi şeylərə Rifqə verir» . Uca Allah fellərində Rəfiqdir. Çünki O, məxluqatını bir dəfədə ya da bir anda yaratmağa güc yetirdiyi halda, hikmətinin və Rifqi olaraq yavaş-yavaş yaratmışdır. Həmçinin digər şəriət qayda-qanunlarını da müəyyən bir mərhələ ilə qadağan etmişdir. İçkinin haram edilməsi, riba və s məsələlərdə.

Rafiq həmçinin də səfərdə birlikdə olmaq, yoldaş mənasında da işlədilmişdir. ***«Onlar necə də gözəl (Rafiq) yoldaşdılar».*** *(ən-Nisa 69).* Allah Rafiqdir. Yəni yumşaqlığı çox olandır. Ziddi sərtlikdir. Allah xeyiri bol olan, xeyir yollarını asanlaşdırandır. Allahın insan oğluna ən böyük asanlıq isə Quranı əzbərliyənlərə asanlaşdırmasıdır. ***«And olsun ki, Biz Quranı ibrət almaq, öyüd-nəsihət qəbul etmək üçün belə asanlaşdırdıq».*** *(əl-Qəmər 32).* Allahın asanlaşdırması olmasaydı heç kimsə Quranı asanlıqla əzbərləməzdi. Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «Allah Rafiqdir. Tələsməyən deməkdir. Çünki tələsmək itirməkdən və qaçırmaqdan qorxanlar üçündür. O, isə hər şey əlində olan, tələsməyəndir. Allah yumşaqlığı sevər isə – Allah işlərində və əməllərində tələsməyənləri sevər deməkdir».

# RAZZAQ – RAZİQ

***ər-Razzaq – «Heç şübhəsiz ki, ruzi*** *(RAZZAQ)* ***verən, O mətin qüvvət sahibi olan Allahdır».*** *(əz-Zariyat 58).* Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «**Razzaq –** ruzini bol-bol və geniş şəkildə verəndir». Buna görə də hər bir müsəlman Allahdan başqa ruzi verən Razzəq olmadığını bilməlidir.

***ər-Raziq – «Sən ruzi verənlərin ən xeyirlisisən».*** *(əl-Maidə 114).* ***«Allah dilədiyinə hesabsız ruzi verir».*** *(əl-Bəqərə 212).* ***«Yer üzündə ruzi əldə edə bilməyən neçə-neçə canlılar vardır. Onların da, sizin də ruzinizi Allah verir».*** *(əl-Ənkəbut 60).* Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «**Raziq –** bədənlərin sağ qalması üçün vacib olan şeyləri verən, ehtiyac duyduqları nemətləri onlara verən deməkdir». Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in dövründə qiymətlər artmağa başladı. İnsanlar: "Ey Allahın Rəsulu! Qiymətlər artdı. Bizə bir qiymət təyin et (Qiymətlərə hədd qoy)" dedilər. Peyğəmbər: "Qiymətləri tənzimliyən Allahdır, Genişlədib çox-çox verən (Bəsit) Allahdır, Ruzi (Raziq) verən Allahdır, Daraldıb (Qabid) qıtlıq gətirən də Allahdır. Mən Allaha yanımda kimsənin mal və qan haqqı olamadığı halda çatmağı ümüd edirəm" deyə buyurdu .

# RƏBB

***ər-Rəbb – «Həmd yalnız aləmlərin Rəbbi olan Allaha aiddir».*** *(əl-Fatihə 1).* İbn Abbas – *radıyallahu anhu* - rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Rəbb olaraq Allahdan, din olaraq İslamdan və Rəsul olaraq Muhəmməddən

---

[200] Müslim 2592.
[201] Müslim 2593.
[202] ***Riba*** – dörd mərhələdə haram edilmişdir. 1) Rum 39. 2) Nisa 160,161,. 3) Ali İmran 130. 4) Bəqərə 275-279.
[203] Əbu Davud 3451, Tirmizi 1314, əl-Albani "Səhih Sünən Tirmizi" 2/32, "Səhih Sünən İbn Məcə" 2/15.

razı olan kimsə imanın şirinliyini, tamını tapar» . ***Rəbb*** – kəliməsinin malik (sahib) mənasında olduğu da söylənilmişdir. Bu durumda aləmlərin Rəbbi (sahibi) doğru bir ifadədir. Çünki aləm kəliməsi bütün varlılıqları əhatə edər. ***«Firon dedi: «Aləmlərin Rəbbi nədir?». Musa: «Əgər yəqin inanacağsansa O, göylərin, yerin və onların arasında olanların Rəbbidir!» deyə cavab verdi».*** *(əş-Şuəra 23,24).* ***Rəbb*** – daha çox ibadət edilən Məbud mənasında işlədilir. Qəbr əzabına aid hədisdə: «Rəbbin (məbudun) kimdir?» deyə soruşurlar. Uca Allah qulların həqiqi məbududur. O, bütün mal, mülk və insanların maliki və sahibidir. Bütün varlıqları yaradan və ruziləndirən Odur. Ondan başqa olan bütün rəblər nə yarada bilərlər, nə də ruziləndirə. Bütün varlılıqlar yoxdan yaradılmışlar. Hamısı Onun mülküdür. Hər şey Onun əmri ilə var olmuşdur. Allah hər şeyə sahibdir. Heç bir şey Onun mülkündən kənara çıxa bilməz. Uca Allah mülkündə dilədiyi şəkildə hərəkət edən malik, itaət edilən, əmrinin altındakıları idarə edən, onları tərbiyə edən və işlərini dilədiyi şəkildə düzəldən və yoluna qoyandır. Allah hər şeyin Rəbbi və məlikidir. O, əvvəlkilərin də sonrakıların da Rəbbidir. Məğribin də məşriqin də, göylərin və yerin, ikisi arasında olanların, dünyanın və axirətin maliki və sahibidir. Mülk Onundur. Mülkündə Ona şərik olan kimsə yoxdur. O, mal və mülkü dilədiyinə verir, dilədiyindən də alır. Dilədiyini əziz, dilədiyini də zəlil edir. Dilədiyini xoşbəxt, dilədiyini də bədbəxt edir. Dilədiyini ucaldır, dilədiyini də alçaldır. Dilədiyinə qız, dilədiyinə də oğlan, dilədiyinə də əkiz oğlan və ya qız uşağı, dilədiyinə də heç övlad bəxş etməz.

O, hər şeyi bilən güc və qüdrət sahibidir. Gecədən gündüzü, gündüzdən də gecəni çıxarır. Ölüdən diri, diridən də ölü çıxaran da odur. Ölümdən sonra yer üzünü təkrar dirildən Odur. Kimisini güldürən, kimisini də ağladan Odur. Kimisini yaşadan, kimisini də öldürən, insanları cift-cift, kişi və qadın olaraq mənidən (spermadan) yaradan odur. Kimisinə bol mülk verərək zəngin edən, kimisinə də mülk verməyərək kasıb edən Odur. Var edəndə, yox edəndə Odur, başladan və sona çatdıran da Odur. Göyləri düşməməsi üçün tutub saxlayan, gecəni qaranlıq, gündüzü aydın, yer üzünü döşək kimi sərən və qullarının yer üzündə yaşamalarını asanlaşdıran, dağları yer üzünün dirəkləri edən, göy üzünün yer üzünə düşməsinə mane olan, gəmiləri əmri ilə dənizdə üzməsinə, qaranlığın ardıyca səhəri gətirən, gecəni insanlar üçün bir dincəlmə edən Odur. Günəş və ay Onun əmri ilə hərəkət edərlər. Nə günəş ayı keçə bilər, nə də gecənin gündüzü keçməsi mümkündür. Hər biri öz axarı ilə hərəkət edərlər. İnsanı yaradan Odur. İnsana qulaq, göz, qəlb verən Odur. Lakin insanlar nə az şükr edərlər. Qiyamət günü bütün insanları dirildən, dənizlərin bir-birinə qarışmasına mane olan, qullarına saysız-hesabsız ruzi verəndir. Buna görə də bu İsimlə heç kəsi nə çağırmaq, nə də müraciyət etmək olar. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurur: «Sizdən heç kim öz (qulluqçusuna) Rəbbinə su ver, Rəbbini doydur, Rəbbinə dəstəmaz aldır və s deməsin. (Ey kölələr!) Sizdən də heç kimsə Rəbbim deyə xitab etməsin. Həmçinin qulum deyə xitab etməsin. Oğlum, qızım desin (Başqa rəvayətdə: Əslində qul və kölə sizsiniz, Allah isə Rəbbdir)» .

---

[204] Müslim 34.
[205] Müslim, Əbu Davud 4975.

# DƏİM

***əd-Dəim* –** Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Zəmanəni söyməyin. Çünki Allah zəmanənin özüdür» .

# DƏYYƏN

***əd-Dəyyən* -** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Qiyamət günü insanlar lüt olaraq həşr olunacaqlar... Sonra bir Carçı uzaq və yaxın olanında eşitdiyi bir səslə: "Mən Məlikəm, Mən Dəyyənəm"[207].

# SƏLAM

***əs-Səlam*** – Bu İsimlə isimlənməyə Uca Allah digər məxluqatdan daha mustəhaqdır. Çünki O, bütün ayıblardan, nöqsanlardan Səlamdır. ***«Quddusdur*** *(nöqsanlıqdan münəzzəhdir),* ***Səlamdır*** *(zat və sifətlərində, fellərində hər cür qüsur və əskiklikdən uzaqdır)****»****. (əl-Həşr 22-24).* Müsəlmanların sözlərinə gəlincə isə: ***Əssələmu Aleykum*** – ona salam verilənə aldatmaqdan, öldürməkdən, ondan gələcək çirkin şeydən salamatını bildirir. O, da eyni qarşılığı verərək Uca Allah eynisini sənə də nəsib etsin. Rəhmət və bərəkətə gəlincə isə bu ikisi yalnız Allaha izafə edilir. Buna görədir ki: Mənim bərəkətim və rəhmətim sizin üzərinizə olsun – deyilməz, Məndən səlam sizin üzərinizə olsun – deyilə bilər. Səlam nöqsanlardan və ayıblardan salim olandır. Səlam ilə isimlənməsi Salim deyə isimlənməsindən daha bəlağətlidir. Məxluqatını zülmdən salamata çıxardır. Uca Allah qədr gecəsini ***Səlam***, Cənnəti ***Darus-Səlam***, Cənnət əhlinin salamlaşmasını isə ***Səlam*** deyə vəsfləndirmişdir. ***«Onları Rəbbinin yanında əmin-amanlıq yurdu*** *(Cənnət)* ***gözləyir».*** *(əl-Ənam 127).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – namazdan sonra dua edərək: «***Allahummə Əntəs Sələmu Və Minkəs Sələmu Təbəraktə Yə Zəl Cələli Vəl İkram*** – Ey Allahım! Səlamsan və Səlam Səndəndir. Sən Ucasan. Ey Cəlal və İkram sahibi» . O, Sifətlərində bütün ayıblardan və nöqsanlardan Səlamdır. O, fellərində bütün ayıblardan və nöqsanlardan, şərlərdən, zülmdən Səlamdır. O, hər yöndən və hər etibar ilə haqq olan Səlamdır. Onun həyatı ölümdən, yatmaqdan və mürgüləməkdən Səlamdır. Qayyumiyyəti və Qüdrəti yorğunluqdan və zorluq çəkməkdən Səlamdır. Onun elmi Ondan bir şeyin ayrılmasından və ya Ona unutqanlığın isabət etməsindən, xatırlamaya və düşünməyə ehtiyac duymaqdan Səlamdır. Onun iradəsi hikmətdən çıxmaqdan Səlamdır. Onun kəlimələri yalandan və zülmdən Səlamdır. Mülkində zidlik olmasından, ortağı olmasından, müavini və ya yardımcısı olmasından və ya Onun izni olmadan Onun qatında bir şəfaətçinin olmasından Səlamdır. Ona Uluhiyyətində bir ortağının olmasından Səlamdır. Onun qəzası və qədəri əbəslikdən, zülmdən və açıq olan hikmətinə müxalif olaraq meydana gəlməsinin düşünülməsindən Səlamdır. Onun şəriəti dini ixtilafdan, pozulmaqdan, qulların məsləhətinə zidd olmaqdan, onlara rəhmət olmaqdan, ehsan olmaqdan və hikmətinə zidd olmaqdan Səlamdır. Əksinə Onun şəriəti hikmətdir, məsləhətdir və ədalətdir. Onun nemətlər verməsi yaltaqlıq

---

[206] Müslim 2246, İbn Məndə "Tovhid" 2/118, Əhməd 2/395,491.
[207] İmam Əhməd "Musnəd" 3/495, əl-Albani "Səhih".
[208] Müslim 591.

olmaqdan və nemət verdiyi kimsəyə ehtiyac duymaqdan Səlamdır. Allahın ərşə istivası, ərşi daşımağa ehtiyac duymasından və istivaya möhtac olmaqdan Səlamdır. Əksinə ərş və onu daşıyanlar Ona möhtacdırlar. ***«Özünə heç bir övlad götürməyən, mülkündə heç bir şəriki olmayan, zəif, aciz olmadığı üçün heç bir dosta, hamiyə ehtiyacı olmayan Allaha həmd olsun!».*** *(əl-İsra 111).* Səlam, səlam verilənə dua və onun səlamətə yetişməsini istəməkdir. Allah Ondan səlam tələb ediləndir, yoxsa Onun üçün salam tələb edilən deyildir. Əksinə Allah qullarına salamatlıq verəndir. ***«Göndərilən bütün Peyğəmbərlərə salam olsun».*** *(əs-Saffət 181).* ***«Salam olsun İbrahimə».*** *(əs-Saffət 109).* ***«Doğduğu gün, öləcəyi gün və diri olaraq qəbirdən qaldırılacağı gün ona salam olsun».*** *(Məryəm 15).* Səhabələr: Allaha salam olsun» deyərdilər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Salam Allaha olsun deməyin. Şübhəsiz ki, Allah özü Səlamdır» deyə buyurdu . ***«Rəhimli Allahdan*** *(onlara)* ***salam vardır».*** *(Yasin 58).*

## SƏMİ’

***əs-Səmi*’** – eşidən olmasının mənası nə qədər yavaş olursa olsun, bütün səsləri idrak edən (eşidən) deməkdir. O, yaratdıqlarının eşitmələrinə bənzəməyən bir sifət olan səmi sifətilə gizli və açıq hər bir şeyi eşidir. Allahın ***Səmi*’** – sifəti iki yerə bölünür. 1. ***Səmi*’ *İcabə*** – qəbul etmək. Məs: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – rukudan qalxaraq deyərdi: «***Səmiallahu Limən Həmidəh*** – Allah ona həmd edəni eşitdi» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allahummə! Təslim olmayan qəlbdən, eşidilməyən duadan Sənə sığınıram» . 2. ***Səmi*’ *İdrak*** – dərk etmək. Bu özü də üç yerə bölünür. 1) ***Təyyid*** – kömək. ***«Qorxmayın, mən də sizinləyəm.*** *(Hər şeyi)* ***eşidirəm və görürəm!».*** *(Ta ha 46).* 2) ***Təhdid*** – hədələmək. ***«Yoxsa onlar elə güman edirlər ki, biz onların pıçıltılarını və xəlvəti danışıqlarını eşitmirik! Xeyr, yanlarında olan elçilərimiz yazırlar.*** *(Ya Peyğəmbər!)* ***De ki: Əgər Rəhmanın bir övladı olsa*** *(Ona)* ***ibadət edənlərin birincisi mən olaram!».*** *(əz-Zuxruf 80).* ***«Allah kasıbdır, biz isə dövlətliyik! Deyənlərinin sözlərini Allah, əlbəttə eşitdi».*** *(Ali İmran 181).* 3) Allahın eşitməsi hər bir şeyi əhatə edir. Onun eşitməsi bütün səsləri əhatə edir. Məxluqatın səsləri Ona qarışıq gəlməz. Bir-birinə bənzəyən səslər Onu aldatmaz. O, səslərdən birini eşitməsi başqa bir səsi eşitməkdən Onu yayındırmaz. ***«Şübhəsiz Rəbbim duanı eşidəndir».*** *(İbrahim 39).* ***«Əgər sənə şeytandan bir vəsvəsə gəlsə Allaha sığın. Şübhəsiz ki, Allah eşidən və görəndir».*** *(əl-Əraf 200).* Aişə – *radıyallahu anhə* - deyir: «Bir qadın ərindən şikayət etmək üçün Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in yanına gəlir. Mən otağın bir küncündə olmağıma baxmayaraq onların nə barədə söhbət etdiklərini eşitmədim. Lakin Allah eşidib ayə nazil etdi. ***«Əri barəsində səninlə mübahisə edən və Allaha şikayət edən qadının sözünü Allah eşitdi. Allah sizin danışığınızı eşidir. Həqiqətən Allah eşidən və görəndir».*** *(əl-Mucadələ 1)* . Əbu Musa - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ey insanlar sakit olun! Siz nə bir

---

[209] Buxari «Əzan» 148, Müslim «Salət» 56.
[210] Buxari, Müslim.
[211] Tirmizi 5/519, Əbu Davud 2/92.
[212] Buxari.

kara, nə də burda olmayan birisinə dua edirsiniz. Siz hər şeyi eşidən və yaxın olana dua edirsiniz» .

## SEYYİD

***əs-Seyyid*** **–** Bu isim Qurani Kərimdə zikr edilmir. Hədislərbə isə belə zikr edilir. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in yanına Bəni Amrdən bir qrup gələrək dedilər: «Sən bizim Seyyidimizsən». Peyğəmbər: «Seyyid Allahdır» deyə buyurdu. Onlar: «Sən bizim böyügümüz və şərəflimizsən» dedilər. Peyğəmbər: «Öz sözlərinizi deyin! Şeytanın sizə öyrətdiyi kimi mənə müraciət etməyin» deyə buyurdu . Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in yanına bir qrup insanlar gələrək: «Ey Allahın elçisi! Ey bizim ən yaxşımız və ən yaxşımızın oğlu, bizim seyyidimiz və seyyidimizin oğlu!» dedilər. Peyğəmbər: «Məni özünüz bildiyiniz kimi çağırın, şeytan sizi yoldan çıxartmasın! Mən Allahın qulu və elçisi Muhəmmədəm. Sevmirəm ki, siz məni qüdrət və cəlal sahibi Allahın layiq bildiyindən yuxarı qaldırasınız» . ***Seyyid*** **–** mütləq olaraq möhtac olunan deməkdir. İnsanların Seyyidi (ağası, böyüyü) dedikdə əmrini yernə yetirdikləri, sözünü dinlədikləri, müraciət etdikləri kimsə mənasına gəlir. Mələklər, insanlar və cinlər Uca Allahın yaratdıqları varlılıqlardır. Bu varlılıqlar Onsuz var olmamışlar. Çünki hər bir varlıq sonradan yaradılmışdır. Allah isə heç bir varlıq yox ikən vardı. Əgər Allah onları yaratmasaydı bu varlıqlar var olmayacaqlardı. Eyni şəkildə var olduqdan sonra da Allah onlara yaşama fürsəti verməsəydi yenə də var olmayacaqlardı. Həqiqət bu olduğuna görə də Allah bütün varlılıqların Seyyidi olmağa daha layiqdir. Varlılıqların bu İsimlə Ona dua etmələri Allahın onlar üzərindəki bir haqqıdır».

## SUBBUH

***əs-Subbuh*** **–** Bu İsim Qurani Kərimdə deyil Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in hədislərində zikr edilir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ruku vəziyyətində belə dua edərdi: «***Subbuhun Quddusun Rabbul Mələikəti Vərruhi*** – Ey heç bir ayıbı və qüsuru olmayan! Ey mələklərin və ruhun Rəbbi!» . Təsbih və tənzih edilən, ucalan. Ayıb və nöqsanlardan uzaq olan deməkdir.

## SAMƏD

***əs-Saməd*** **–** Qurani Kərimdə sadəcə İxlas surəsində bu isim keçməkdədir. ***«Allah Səməddir*** *(heç kəsə və heç nəyə möhtac deyildir. Hamı ona möhtacdır, O əzəli və əbədidir)****».*** *(əl-İxlas 2).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bir nəfərin dua edərək: «Allahım! Səndən başqa ilah yoxdur, Sən Əhəd, Saməd, doğmamış və doğulmamış və heç bir oxşarı olmayan Allah olduğuna şəhadət edərək səndən istəyirəm» dediyini eşitdi. Peyğəmbər: «Nəfsim əlində olana and olsun ki, o adam Allahın ***İsmil Azam*** – əzəmətli ismi ilə dua etdiyi zaman mütləq qəbul olundu və

---

[213] Buxari, Müslim.
[214] Əbu Davud 4806, Əhməd 4/25, Buxari "Ədəbul Mufrad" 211, Nəsəi "Əməli Yəvmul Leyl" 2482, əl-Albani "Səhih Cəmi" 3594.
[215] Əhməd 3/153,241.
[216] Müslim 487.

onunla istədiyi zaman mütləq istəyi verildi» . İbn Abbas – *radıyallahu anhu* – deyir ki: «***Saməd*** **–** Heç bir ehtiyacı olmayan və heç kimə möhtac olmayandır». Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «***Saməd*** **–** mühüm işlərdə yönənilən, fəlakət və ehtiyac anlarında müraciət edilən deməkdir. Saməd qəsd etmək, yönəlmək mənasındadır». İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «***Saməd*** **–** güc və qüvvəti sonsuz, hər şeyi bilən, əsla heç bir şeyi unutmaz. Göyləri və yerləri və ikisi arasında olanları yönəldib idarə edən Odur. O, bütün varlılıqların yaradıcısı olduğu kimi bu valılıqların Rəbbi və məlikidir. Belə olan bir Rəbbin bənzəri əsla olmaz. Çünki O, bütün Sifət və fellərində bənzərsizdir».

## SADİQ

***əs-Sadiq*** **–** Bu İsim Quranda həm İsim, həm də fel olaraq da keçər. ***«Biz şübhəsiz ki, doğru olanlarıq».*** *(əl-Ənam 146).* ***«Allahdan daha doğru sözlü kim vardır».*** *(ən-Nisa 87,122).* ***"Biz sənə*** *(Allahdan)* ***doğru xəbər gətirmişik. Biz, həqiqətən, doğru danışanlarıq!".*** *(əl-Hicr 64).* Bu İsim insanlar haqında da işlədilir. Doğruluğu çox olan kimsəyə də sıddıq deyilir. Sidq yalanın ziddidir. Musaddiq doğrulayan deməkdir. Sıddıq daima doğru söyləyən, doğruluqdan ayrılmayan və doğruluğu çox olandır. Bu söz daha çox sözlərini əməlində doğrulayan üçün işlədilir. Sən də Allahın ayələrini, möcüzələrini, dəlillərini, isimlərini, sifətlərini, fellərini, hökmlərini və sözlərini doğrula və bunlara qəlbdən inan. ***«Allah sizə verdiyi sözündə sadiq qaldı».*** *(Ali İmran 152).* Allah sadiqdir və hər sözü doğrudur. Allah qullarına veriyi hər vədi gerçəkləşdirir. Hər bir şeyin təməli doğruluq üzərində qurulur. Buna görə də hər sözündə və davranışında doğru olan, doğruluğunu gerçəkləşdirən qurtulmuşdur. Sən də qurtulmaq üçün doğru olmağa çalış ki, adın doğru olanlar arasında çəkilsin. ***«Möminlər içərisində elələri də vardır ki, Allahla etdikləri əhdə sadiq olarlar».*** *(əl-Əhzab 23).* ***«Həqiqətən bunlar doğru olanlardır…».*** *(əl-Bəqərə 177).* Allah sözlərində doğru olmayanlara da xitab edərək: ***«Əgər onlar Allaha verdikləri sözdə sadiq olsalardı bu onlar üçün daha xeyirli olardı».*** *(Muhəmməd 21).*

## SİTTİR

***əs-Sittir*** **–** Beyhəqi – *rahmətullahi aleyhi* – deyir ki: «***Sittir*** **–** örtən deməkdir. Allah qullarının bir çox ayıblarını və qüsurlarını örtər. Onları ortaya çıxarıb insanlar arasında rəzil etməz. Buna görə də qullarda öz ayıblarını və qüsurlarını örtərək, onları ləkələyəcək əməllərdən qaçmalıdırlar» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Həqiqətən Əziz və Cəlil olan Allah Həyalı və Örtəndir..."[219].

## SƏTTƏR – SƏTİR

***əs-Səttər*** **-** ***əs-Sətir*** **-** Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər kim bir mömini dünya sıxıntılarının birindən qurtararsa, Allah onu Qiyamət gününün sıxıntılarının bir sıxıntısından qurtarar. Hər kim çətinliyə düşənin çətinliyini yüngülləşdirərsə, Allah da o, kimsəyə

---

[217] Əbu Davud 1493, Əhməd 3/120,158,225, Tirmizi «Dəvət» 63.
[218] Beyhəqi «Əsməul Husnə» s. 91, 484.
[219] Nəsəi 1/200, əl-Albani "Səhih Nəsəi" 1/86-87, H. 393.

dünya və axirətdə asanlıq, yüngüllük verər. Hər kim bir müsəlmanın qüsurunu (yəni xətasını) ***Sətərə*** örtərsə, Allah da dünya və axirətdə onun qüsurunu (xətasını) örtər...» .

## ŞƏDİD

***əş-Şədid* – *“Göy gurultusu Onun şəninə tariflər deyir, mələklər də*** *(Allahın)* ***qorxusundan*** *(Onu öyüb mədh edirlər).* ***O, ildırımlar göndərib*** *(kafirlər)* ***Allah barəsində mübahisə edərkən onlarla istədiyini vurar. Allahın cəzası şiddətlidir!*** *(Allah yenilməz qüvvət sahibidir!)****”.*** *(ər-Rəd 13).*

## ŞƏKİR – ŞƏKUR

***əş-Şəkir*** – Allah Özünü Şəkir və Şəkur deyə İsimləndirmişdir. Şükr edənləri də bu iki İsimlə adlandırıb onlara Öz sifətini vermiş və onları bu İsimlə isimləndirmişdir. Allah şükr edən qullarından razı olur. ***«Hər kəs könüllü olaraq yaxşı bir iş görərsə Allah razı qalan*** *(ŞƏKİR)* ***və biləndir».*** *(əl-Bəqərə 158).* ***«Əgər şükr etsəniz sizdən razı olur».*** *(əz-Zumər 7).* Şükr edənlərin kainatda az olması, onların seçilmiş qullar olduğu da bəllidir. ***«Lakin qulları içində şükr edən azdır».*** *(əs-Səbə 13).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ayaqları şişənə qədər namaz qılmış və ona: «Allah sənin keçmiş və gələcək günahlarını bağışlamışdır. Sən nə üçün bu qədər ibadət edirsən?» deyildikdə. O: «Allaha şükr edən bir qul olmayımmı?» deyə buyurdu . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* –: «Ey Muaz! Vallahi səni sevirəm. Beləki hər fərz namazından sonra bu duanı et: ***«Allahummə Əinni Alə Zikrikə Və Şukrukə Və Husni İbədətikə*** – Allahım! Səni zikr etmək, Sənə şükr etmək və Sənə gözəl ibadət etmək üçün mənə yardım et» .

***əş-Şəkur*** – Azacıq təşəkkürə çox qarşılıq verən İsmi Qurani Kərimdə **4** yerdə keçməkdədir. ***«Həqiqətən Allah bağışlayandır və qədirbiləndir!*** *(ŞƏKUR)****».*** *(əş-Şura 23).* Şükür mərtəbəsi ən ucadır. Bu mərtəbə ***Riza*** – mərtəbəsinin üztündədir. Riza şükrün içərisində yer almaqdadır. Şükr rizasız olmaz. Şükr imanın yarısıdır. İman iki qismə ayrılır. Yarısı şükr və yarısı da səbrdir. Uca Allah qullarına şükrü əmr edər və şükrün ziddinə olan şeyləri isə qadağan edər. Şükr edən kimsələri tərif edər, onlara ən gözəl mükafatı verər. ***«Mənə şükr edin, nankorluq etməyin».*** *(əl-Bəqərə 152).* ***«Allah şükr edənləri mükafatlandıracaqdır».*** *(Ali İmran 144).* ***«O, halda Ona ibadət edin və Ona şükr edin. Ona qaytarılacaqsınız».*** *(əl-Ənkəbut 17).* Şükr qəlb üçün bir sevgi və yönəlməkdir. Dil üçün bir tərif və həmddir. Bədən orqanları üçün isə itaət və görəvdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnsanlara təşəkkür etməyən Allaha şükr etməz» . Davud – *əleyhissəlam* – buyurur: «Ey Rəbbim! Sənə necə şükr edim ki, neməti verən, onunla ruziləndirən, sonra da nemət üstünə nemət verərək artıran Sənsən. Nemət də Səndən, şükr də Sənədən. (şükrüm belə Sənin bir nemətindir) Necə bunlara şükr edim». Allah: «İndi Məni tanıdın və Mənə şükr etdin ey Davud! Çünki şükr etməyin də Mənim bir nemətim olduğunu bildin». Başqa rəvayətdə: «Ey Rəbbim! Vücudumdakı tüklərdən hər birinin iki dili olsa da belə gecə və gündüz bütün

---

[220] Buxari 2442, Müslim 2699.
[221] Buxari «Təhəccüd» 6, Müslim «Sifətul Munafiqun» 2819.
[222] Əbu Davud «Vitr» 26, Nəsai «Səcdə» 60, Musnəd 2/299.
[223] Tirmizi 1955.

vaxtlarda Səni zikr etsələr də belə yenə də mənə verdiyin nemətin haqqını belə vermiş olmaram» .

## ŞƏHİD

***əş-Şəhid*** – Bu İsim Qurani Kərimdə **20** yerdə keçməkdədir. Hər şeyə şahid olan, heç bir şeyi unutmayandır. ***«…Sən canımı aldıqdan sonra onlara nəzarətçi Özün oldun. Yalnız sən hər şeyə Şahidsən».*** *(əl-Maidə 117).* ***«Doğrusu Allah hər şeyin üzərində şahid olandır».*** *(əl-Həcc 17).* ***«Şahid olaraq Allah yetər».*** *(ən-Nisa 79).* *«(Ya Peyğəmbərim!)* ***Sən nə iş görsən Qurandan nə oxusan, nə iş görsəniz, onlara daldığınız zaman Biz sizə şahid olarıq. Yerdə və göydə zərrə qədər bir şey Allahdan gizli qalmaz».*** *(Yunus 61).* ***"Onu*** *(İslamı)* ***bütün dinlərdən üstün etmək*** *(onun bütün dinlərdən üstün olduğunu göstərmək)* ***üçün Öz Peyğəmbərini hidayət və haqq dinlə göndərən Odur.*** *(Ya Rəsulum! Sənin peyğəmbərliyinin həqiqiliyinə)* ***Allahın şahid olması kifayət edər!".*** *(Fəth 28).* Allah, Şəhiddir. Çünki Şəhadət kəliməsi ilə qullar Onun bir olduğuna şahidlik etməkdə, beləcə Ona ibadət etməyi qəbul etdiklərini göstərmiş olmaqdadırlar. ***«Onları öz nəfslərinə qarşı şahidlər etmişdi».*** *(əl-Əraf 172).* Bu ayədə Allah qullarından Onun birliyinə şahidlik etmələrini tələb etmiş, qullar da bu tələbi yerinə yetirərək Allahın birliyinə şahidlik etmişlər. Bu həqiqi şahidlik olmaqla birlikdə Allaha şahidlik edildiyini göstərməkdədir. Allah da Özündən başqa İlahın olmadığına şahiddir. ***«Allah özündən başqa heç bir ilah olmadığına şahidlik etdi».*** *(Ali İmran 18).*

## ŞƏFİ

***əş-Şəfi*** **–** Bu İsim Qurani Kərimdə fel olaraq zikr olunur. ***«Xəstələndiyim zaman mənə Şəfa verən Sənsən».*** *(əş-Şura 80).* Hədisdə isə həm Fel, həm də İsim olaraq keçir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bir xəstənin yanına gəldiyi zaman belə dua edərdi: «Ey insanların Rəbbi! Bu sıxıntı və dərdi apar. Şəfa ver! Çünki şəfa verən sənsən. Səndən başqa şəfa verən yoxdur. Xəstənin bütün xəstəliklərini aparan bir şəfa ver!» . Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «Allah şək və şübhələri, həsət və kini qəlblərdən silib könüllərə şəfa verdiyi kimi hər cür xəstəlikləri, bəla və müsibətləri qaldırıb bədənlərə də şəfa verir. Ondan başqa kimsənin buna gücü yetməz. Bu üzdən bu isimlə yalnız Ona dua edilir». Buna görə də hər bir müsəlman şəfanın yalnız Allahdan gəldiyinə inanmalıdır. İnsan yalnız Onun şəfa verməsi ilə yaxşılaşır və şəfa tapır.

## AZİZ

***əl-Aziz*** – Qiymətli, izzət sahibi, möhtərəm, qüvvətli, heç vaxt yenilməyən, üstün, uca, şərəf sahibi. ***Azzə*** **-** kökündən gəlməkdədir. Hər şeyə gücü çatandır. İzzət – tam olaraq zillətin, düşkünlük, aşağı olmaq, acizliyin ziddidir. ***«O, Əzizdir, Həlimdir*** *(yenilməz qüvvət və hikmət sahibidir)».* *(əl-Həşr 22-24).* O, izzətinin mükəmməliyi ilə qullarına hökm edən və bu hökmü onlar üzərində icra edəndir. Allah qullarının qəlblərini və iradələrini dilədiyi tərəfə çevirəndir. O, dilərsə qul ilə qəlbi arasına girər.

---

[224] İmam Əhməd «Kitabu Zuhd» 361,362.
[225] Buxari "Kitabu Tibb" 5675, "Fəthul Bəri" 10/210, H. 5750, Müslim "Kitabu Səlam" 2191.

Qurani Kərimdə **91** yerdə keçməkdədir. Heç vaxt tək zikr edilməmiş. Başqa bir isimlə zikr edilmişdir. Bu İsmin keçdiyi **91** ayədən **50**-si Məkkədə, **41** isə Mədinə surələridir.

## ALİM - ĀLİM – ALLƏM

***əl-Alim*** – ***əl-Ālim* -** Əzəli elmi ilə, böyük-kiçik, gizli-aşkar, yaradılmış-yaradılmamış hər şeyi biləndir. Heç bir şey Onun elmindən qırağa çıxa bilməz və Ona gizli qalmaz. O, hər şeydən xəbərdardır. Onun elmi hər cür sirləri, gizli işləri, qəlblərin gizlətdikləri şeyləri, qeyb məsələlərini, məsələlərin arxa planlarını, hər şeyin ən incə və gizli tərəflərini əhatə edir. ***«Hər şeyi bilən Sən, hikmət sahibi Sənsən».*** *(əl-Bəqərə 32).* ***«Yerə daxil olanı da, yerdən çıxanı da, göydən enəni də, göyə qalxanı da O, bilir».*** *(Səba 2).* ***«Göylərdə və yerdə zərrə qədər bir şey Ondan gizli qalmaz»*** *(Səba 3).* ***«Qeybin açarları Allahın yanındadır. Onları ancaq Allah bilir. Allah suda və quruda nə varsa bilir. Elə bir düşən yarpaq yoxdur ki, Allah onu bilməsin. Yerin zülmətləri içində elə bir toxum*** *(kainatda)* ***elə bir şey yoxdur ki, məhz açıq-aydın kitabda olmasın».*** *(əl-Ənam 59).* ***«O, bilmədən heç bir meyvə qabığından çıxmaz, heç bir qadın hamilə olmaz və bari-hamiləni yerə qoymaz».*** *(Fussilət 47).* ***«Ey Rəbbimiz! Sənin rəhmin və elmin hər şeyi ehtiva etmişdir».*** *(əl-Mumin 7).* ***«Mən sizin bilmədiklərinizi bilirəm».*** *(əl-Bəqərə 30).* Onun üçün qeyb və bilməməzlik deyə bilinən bir şey yoxdur. O, hər hansı bir şeyi idrak etməkdən aciz deyildir. Lakin insanlar isə çox şeyləri idrak etməkdən acizdirlər. Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «***Alim*** **–** insanların bilmədikləri və idrak etmədikləri sirləri və gizlilikləri biləndir. Alim ən mükəmməl elm sifətinə sahib olandır». ***"De: "Ey göyləri və yeri yoxdan yaradan, ey gizlini və aşkarı bilən Allah! Bəndələrin arasında ixtilafda olduqları*** *(məsələlər)* ***barəsində Sən hökm edəcəksən!".*** *(əz-Zumər 46).*

***əl-Alləm*** – ***«Allah qeybləri çox gözəl biləndir».*** *(ət-Tövbə 78).* Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «Allah bu an var olan, var olmaqda olanları, var olduqlarında necə olacaqlarını, var olmayanları və əgər var olsalardı necə olacaqlarını biləndir». ***«Şübhəsiz ki, O gizlini də, gizlinin gizlisini də bilməkdədir».*** *(Ta ha 7).* ***«Allah hər şeyi bilməkdədir».*** *(ən-Nisa 176).* ***«Allah zalimləri çox yaxşı tanıyandır».*** *(əl-Bəqərə 95).* ***«Allah onların durumunu haqqıyla biləndir».*** *(ən-Nisa 39).* ***«Əlbəttə Allah fitnə-fəsad törədənləri tanıyandır».*** *(Ali İmran 63).* Bu İsim məşhur istixarə duasında belə keçər: «Şübhəsiz ki, Sən qeyibləri çox gözəl bilənsən»[226]. O, bütün insanları yaratdığı andan etibarən dünyada necə yaşayacaqlarını və öldükdən sonra axirətdə necə yaşayacaqlarını biləndir. Allah bütün insanların yaxşı və pis əməllərini və bu əməllərin axirətdəki nəticələrini incəliyinə kimi biləndir. Allahın elmi görünən və görünməyən, zahir və batin, gizli və aşkar hər şeyi əhatə edir. Heç bir şey Ona gizli deyildir.

## ADL

***əl-Adl*** – Allah sözündə, felində, qəzasında, qədərində, əmrində, qadağan etməkdə, mükafatlandırmaqda və cəzalandırmaqda doğru bir yol üzərədir. Onun bildirmiş olduğu xəbərlərin hamısı doğrudur. Qəzasının hamısı ədalətdir. ***«Rəbbinin sözü doğruluq və ədalət baxımından tamamlandı. Onun sözlərini dəyişdirə biləcək***

---

[226] Buxari 1166.

***yoxdur».*** *(əl-Ənam 115).* Allahın sözləri doğru və ədalətli olduğuna görə Özüdə mütləq ədalət sahibidir. Onun ədalət İsmi haqsızlıq və zülm etmə sifətlərini yox edər. Bu üzdən də O, haqsızlıq və zülm edən deyildir. Onun qərarı doğru, hökmü adildir. İbn Məsud - *radıyallahu anhu –* rəvayət edir ki, Rəsulullah *– sallallahu aleyhi və səlləm –* Huneyn günü qənimətləri bölürdü. Bu bölümdə İslamda yeni olanlara daha çox üstünlük verdi. Bu vaxt bir nəfər: «Vallahi bu iş ədalətli olmadı və Allah rizası bu işdə gözlənilmədi» dedi. Peyğəmbər: «Allah və Rəsulu ədalətli olmasa artıq kim ədalətli ola bilər» deyə buyurdu . Ubey b. Kəbb *– radıyallahu anhu –* deyir ki: «Əgər Allah yerdəki və göydəki bütün varlıqlara əzab etmək istəsəydi onlara əzab edə bilir və buna görə də zülm etmiş sayılmaz. Eyni şəkildə əgər onlara mərhəmət etmək istəsəydi bunu da edə bilirdi və Onun bu rəhməti, qulların əməllərinə qarşılıq deyil onlara olan yaxşılığından sayılardı» .

## AFUV

***əl-Afuv*** *–* Sözdə silmək, yox etmək mənasındadır. ***Afv*** *–* kökündən gələn bir sifət olaraq asanlıqla bağışlayan, qulların günahlarını silən, cəzaları qaldıran deməkdir. ***«Həqiqətən Allah əfv edən və bağışlayandır».*** *(əl-Həcc 60).* Allah qullarının tövbələrini qəbul edər və etdikləri pislikləri bağışlayandır. Çünki O, əfv edicidir. Əfv etməyi sevəndir. Qullarının əfva çatmalarına səbəb olan şeyləri yerinə yetirmək üçün çalışmalarından xoşlanır. Onun sonsuz əfiındən biri də qul nə qədər günah edirsə etsin sonunda Ona yönəlib tövbə edərsə onun etdiyi bütün günahları bağışlayar. Əfv əsən küləyin izləri sildiyi kimi günahların silmək mənasına da gəlir. Günahları bağışlayan, sanki bu əfv ilə günahların izini silməkdir. ***«Bəndələrinin tövbəsini qəbul eən, günahlarını bağışlayan və sizin nə etdiyinizi bilən Odur!».*** *(əş-Şura 25).* Aişə *– radıyallahu anhə –* deyir ki, Peyğəmbər *– sallallahu aleyhi və səlləm –* dən soruşdum: «Ey Allahın Rəsulu! Qədr gecəsinə yetişsəm nə söyləyim?». Peyğəmbər: ***Allahummə İnnəkə Afuvvun Kərimun Tuhibbul Əfvə Fəfu Ənni –*** Allahım Sən bağışlayansan, səxavətlisən və bağışlamağı sevirsən. Məni bağışla» . Bu İsmin insanlar üçün işlədilməsi caizdir. ***«Onlar insanları bağışlayanlardır».*** *(Ali İmran 134).* Əfv hər zaman əfv etməklə, bağışlamaqla və cəzalandırmamaqla bilinəndir. Hər kəs Onun mərhəmət və kərəminə möhtac olduğu kimi əffinə və bağışlamasına da möhtacdırlar. Əfv günahların izlərini tam aradan qaldırması, onları Kiramən Kətibin mələklərinin yazdığı dəftərlərdən silməsi, qiyamət günü qullarını bu günahlardan sorğuya çəkməməsi, xatırladıqda utanmamaları üçün bu günahları onlara unutdurması və hər pisliyin yerinə yaxşılıq qoymasıdır. ***«Allah istədiyi şeyi məhv edər, istədiyini də sabit saxlayar*** *(bəndələrinə aid hər hansı bir hökmü ləğv edib başqası ilə dəyişər və ya onu olduğu kimi saxlayar)****».*** *(ər-Rəd 39).* ***«Allah onların pis əməllərini yaxşı əməllərə çevirər».*** *(əl-Furqan 70).* Əfv, məğfirətdən daha genişdir. Çünki məğfirət günahların örtüldüyünü, əfv isə onların izlərini belə sildiyini bildirir. Ənəs - *radıyallahu anhu –* rəvayət edir ki, Peyğəmbər *– sallallahu aleyhi və səlləm –* in belə buyurduğunu eşitdim: «Allah *– subhənəhu və təalə* - buyurdu: «Ey Adəm oğlu! Nə qədər ki, sən mənə dua edib məndən bağışlanma diləsən, mən sənin nələr etdiyinə baxmadan səni

---

[227] Müslim 1062.
[228] Əbu Davud 4699.
[229] Tirmizi 3513.

bağışlayaram. Ey Adəm oğlu! Əğər sənin günahların göylərə qədər çatsa və sonra sən məndən bağışlanma diləsən, mən sənin günahlarını bağışlayaram. Ey Adəm oğlu! Əğər sən mənim hüzuruma yerüzü dolusu qədər günahlarla gəlsən və mənə heç bir şeyi şərik qoşmasan mən də sənə yerüzu qədər bağışlanma verərəm» . Sən də sənə qarşı haqsızlıq edən və sənə pislik edən kimsələri əfv etməlisən. Bilməlisən ki, Allah əfv edənləri sevər.

## ALİ

***əl-Ali*** **–** Alçaqlığın ziddi olan yüksəklik və ucalıq mənasındadır. Allahın ucalığının üstündə heç bir ucalıq yoxdur. Bütün dərəcələr və mərtəbələr Ondan aşağıdır. Çünki Ali alçaqlığın ziddi olan Uluvdan törənmişdir. ***«Ən uca*** *(ALİ)* ***və ən böyük*** *(AZİM)* ***varlıq Odur».*** *(əl-Bəqərə 255).* Hər cür qüsur, pislik və nöqsanlardan uzaq olan deməkdir. Bu İsim ucalıq mənasında gələn ***Uluv*** – kökündən gəlməkdədir. Uluv ust və yuxarı mənasındadır. Allahın vəsfi olaraq yaratdıqları üzərində qüdrətilə ucalıq sahibi olan deməkdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allahım! Səni hər cür nöqsan sifətlərdən təqdis edərim. Rəbbim ən ucadır, Aliy (çox uca) və qarşılıqsız ehsan edəndir» .

## AZİM

***əl-Azim – «O, ən Uca və ən Böyükdür*** *(əzəmətli AZİM)****».*** *(əl-Bəqərə 255).* Abdullah b. Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – sıxıntı anında belə dua edərdi: «Allahdan başqa ibadətə layiq haqq İlah yoxdur. O, Azim və Həlim olandır. Allahdan başqa ibadətə layiq haqq İlah yoxdur. O, böyük ərşin sahibidir. Allahdan başqa İlah yoxdur. O, göylərin və yerin Rəbbidir və O, dəyərli ərşin sahibidir» . Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «***Azim*** **–** böyüklük və ucalıq sahibi olandır». Allahın varlığı hər böyüklükdən daha böyükdür. Onun varlığı əzəli və əbədidir. Başqalarının varlığı isə belə deyildir. O, hər böyükdən daha böyükdür. Bu üzdən də heç bir ağıl Onun böyüklüyünü qavraya bilməz. Heç bir göz Onun izzətini əhatə edə bilməz. Onun əzəmətinin başlanğıcı və ucalığının isə sonu yoxdur. Böyüklük və ululuq yalnız Allaha aiddir. Hər iki vəsfin həqiqəti başa düşülməz və mahiyyətinə varılmaz. İnsanlardan heç kimsə Allahın ucalığı kimi ucalmağı haqq edə bilməzlər. Qullar Allahı qəlbləri, dilləri və bütün əzaları ilə ucaldırlar. Allahın yaratdığı, əmr etdiyi və qadağan etdiyi bir şeyi etiraz etmədən qəbul etmək Allaha sayğının və Onu ucaltmanın bir ifadəsidir.

## ĞAFFƏR - ĞAFUR – ĞAFİR

***əl-Ğaffər – əl-Ğafur – əl-Ğafir – «Agah olun ki, O, yenilməz qüvvət sahibidir,*** *(günahları)* ***çox bağışlayandır*** *(ĞAFFƏR)****».*** *(əz-Zumər 5, Ta ha 82).* ***«****(Ya Muhəmməd!)* ***Qullarıma xəbər ver ki, Mən həqiqətən, bağışlayan*** *(ĞAFUR)* ***və rəhm edənəm».*** *(əl-Hicr 49, əl-Maidə 101).* ***«Günahları bağışlayan (****ĞAFİR****), tövbələri qəbul edən…».*** *(əl-Mumin 3).* Bu isimlər ***Ğa-Fə-Rə*** kökündən törənmişdir. Örtmək,

---

[230] Tirmizi, əl-Albani «Səhih əl-Cəmi» 4214, «əl-Mişkət» 4336, «Təxric ət-Tərğib» 2/268-ci hədis.
[231] İmam Əhməd «Musnəd» 4/54.
[232] Buxari 6345, Müslim 2730.

pərdələmək mənasındadır. Buna görə də döyüşlərdə başı zərbələrdən qorumaq üçün geyinilən şeyə ***Miğfər*** deyilmişdir. Həmçinin başı örtən bez parçasına da, yaraların üzərinə sürtülən və yaraların sağalmasını tezləşdirən bir bitki adından gəldiyi də söylənilmişdir . Halimi – *rahmətullahi aleyhi* – deyir ki: «***Gafir –*** günahkarların günahlarını örtən və onları cəzalandırmayıb insanların önündə rəzil və alçaltmayandır». ***Allahumə Ğfirli*** – Allahım məni bağışla, məni islah et və məni düzəlt mənasındadır. Bu isim Allahın Əfuvv isminə daha yaxındır. Əfuvv günahları silən, Ğafir isə silinən günahın yerinə nuru yerləşdirmək və qulun qüsurlarını örtmək mənasındadır. Qurani Kərim də bir çox yerlərdə zikr olunurlar. ***«Heç şübhəsiz ki, Allah Əfuvv*** *(əff edən),* ***Ğafur*** *(bağışlayandır)****».*** *(əl-Həcc 60).* Halimi – *rahmətullahi aleyhi* – deyir ki: «***Ğaffər –*** qulların günahlarını örtməyə çalışandır. Belə ki, bu günahları nə dünyada, nə də axirətdə ortaya çıxarmaz. Çünki Allah qullarını sadəcə bir dəfə deyil dəfələrlə bağışlayandır. Bu İsimlər Allahın zatı deyil, feli sifətlərindən alınmaqdadır». Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Uca və Böyük olan Rəbbindən belə buyurdu: «Allahın qullarından biri günah edib sonra da: «Allahım! Mən günah etdim, günahımı bağışla!» dedi. Pak və Uca olan Allah: «Qulum günah etdi! Günahı bağışlayan (məğfirət edən) və günaha görə cəzalandıran bir Rəbbi olduğunu bildiyi halda! Mən öz qulumu bağışladım!» deyə buyurdu. Sonra o, qul (günah etmədən) Allahın dilədiyi bir müddət qədər yaşayır. Sonra yenə də günah edərək: «Allahım! Mən günah etdim, günahımı bağışla!» dedi. Pak və Uca olan Allah: «Qulum günah etdi! Günahı bağışlayan (məğfirət edən) və günaha görə cəzalandıran bir Rəbbi olduğunu bildiyi halda! Mən öz qulumu bağışladım!» deyə buyurdu. Sonra o, qul (günah etmədən) Allahın dilədiyi bir müddət qədər yaşayır. Sonra yenə də günah edərək: «Allahım! Mən günah etdim, günahımı bağışla!» dedi. Pak və Uca olan Allah: «Qulum günah etdi! Günahı bağışlayan (məğfirət edən) və günaha görə cəzalandıran bir Rəbbi olduğunu bildiyi halda!». Üç dəfə: «Mən öz qulumu bağışladım! Artıq istədiyini edə bilər « deyə buyurdu .

***Qulun Günahdan Törəyən Üç Ismi Vardır –*** **1.** ***Zalim – «Artıq onlardan kim öz nəfsinə zülm edər».*** *(Fatir 32).* **2.** ***Zalum – «Çünki o,*** *(insan)* ***çox zalım, çox cahildir».*** *(əl-Əhzəb 72).* **3.** ***Zallam – «****(Ya Muhəmməd! Mənim adımdan qullarıma)* ***De ki: Ey mənim*** *(günah törətməkdə)* ***özlərinə zülm etməkdə həddi aşmış bəndələrim!»*** *(əz-Zumər 53-54).*

Günah etməkdə həddi aşan kimsə Zallamdır. Sanki Allah belə buyurur: «Ey qulum! Zülm etməkdə və günah etməkdə sənin üç ismin vardır. Buna qarşı Mənim də günahları bağışlamada üç İsmim vardır. Əgər sən günah edərək və zülm edərək Zalım olsan, tövbə etdikdə Mən də Ğafir oluram. Əgər Zalum olursansa, Mən də Ğafur oluram. Əgər sən Zallam olsan, onda Mən Ğaffər olaram. Bu üzdən nə qədər günahın olursa olsun Bizdən ümüdünü üzmə. Tövbə edərsənsə qəbul edərik. ***«De ki: «Sapıqlardan başqa Rəbbinin rəhmətindən kim ümüd kəsər».*** *(əl-Hicr 56).* Allah bu dünyada gözəllikləri ortaya çıxaran, çirkinlikləri və günahları örtən, axirətdə isə çirkinlikləri cəzalandırmaqdan vaz keçib onları bağışlayandır. Onun günahları

---

[233] Qurtubi 1/152.
[234] Bu kəlmələr heç də onu açıqlamır ki, insan istədiyini edə bilər. Xeyr! Bu kəlmələr bizə onu açıqlayır ki, insan günah etdikdən sonra dərhal tövbə edərsə Allah onu bağışlayar.
[235] Buxari 7507, Müslim 2758.

bağışlaması tam və əskiksizdir. Belə ki, bağışlamanın ən üst dərəcəsində Onun məğfirəti vardır.

Hər müsəlman Uca Allahın mütləq məğfirət sahibi olduğunu və yalnız Onun bunu haqq etdiyini bilməlidir. Ondan başqa qulların günahlarını bağışlayan kimsə yoxdur. ***«Kafir olanlar iman gətirənlərə dedilər: Bizim yolumuza tabe olun. Günahlarınızı öz boyunumuza götürərik. Halbuki onların heç bir günahını öz boyunlarına götürməzlər. Onlar həqiqətən də yalançıdırlar. Şübhəsiz ki, onlar həm öz günahları, həm də başqa günahlarla yüklənəcəklər».*** *(əl-Ənkəbut 12-13).* Tövbə edən isə sanki heç günah işləməmiş kimidir. ***«O, müttəqilər ki, bir günah iş gördükləri, yaxud özlərinə zülm etdikləri zaman Allahı yada salıb günahlarının bağışlanmasını istəyərlər. Axı günahları Allahdan başqa kim bağışlaya bilər?».*** *(Ali İmran 135).* ***«Əgər vaz keçərlərsə keçmişdə*** *(etdikləri)* ***şeylər bağışlanacaqlar».*** *(əl-Ənfal 38).* ***«Həqiqətən Mən tövbə edən, inanan, saleh əməllər edib sonra da doğru yola yönələn kimsəni şübhəsiz ki, bağışlayacağam».*** *(Ta ha 82).* ***«Onlar səhər vaxtlarında bağışlanma diləyənlərdir».*** *(Ali İmran 17).* **«Gecə boyunca az yatarlar. Onlar səhər *vaxtlarında istiğfar diləyərlər».*** *(əz-Zariyət 17-18).* Hər bir müsəlman bir günah işlədiyində onu insanlardan gizləməli və əsla açığa çıxarmamalıdır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mənim ümmətimdən mücahirlərdən başqa hamı əff olunacaqdır». Səhabələr: «Mücahirlər kimdir ya Rəsulullah?» dedilər. Peyğəmbər: «Onlar günah edir Allah isə onların günahlarının üstünü örtər. Səhər açılmamış çölə çıxaraq öz günahlarını insanlara bildirərlər» . Bu İsimləri bilən hər bir müsəlman öz günahlarını gizlətdiyi kimi, başqalarının da günahlarını gizlətməli və açığa çıxarmamalıdır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim bir müsəlmanın (xəta və günahını) örtərsə, Allah da dünya və axirətdə o, kimsənin (xəta və günahını) örtər» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir qul dünyada bir qulun (ayıbını) örtərsə, Allah da qiyamət günü mütləq o, qulun (ayıbını) örtər» .

## ĞANİ

***əl-Ğani*** **–** zəngin olmaq, heç bir şeyə möhtac olmayan mənasına gələn ***Ğina*** – məsdərindən sifət olan Allahın gözəl İsimlərindən biridir. Qurani Kərimdə **7** yerdə keçməkdədir. ***«Rəbbin heç bir şeyə ehtiyacı olmayan rəhmət sahibidir».*** *(əl-Ənam 133, əl-Bəqərə 267).* İstər zatında, istərdə sifətlərində, fellərində heç bir zaman, heç bir surətdə, heç bir şeyə möhtac olmayan, hər şeyin Ona möhtac olduğu tək zəngin Odur. Allahın ibadətlərimizə bir ehtiyacı yoxdur. Qurani Kərim bunu bir çox ayələrdə bəyan edir. ***«Qurbanlıq heyvanlarının nə ətləri, nə qanları Allaha çatmaz. Ona ancaq sizdən təqva çatır».*** *(əl-Həcc 37).* O, halda insan Allaha qulluq edərkən, Onun əmrlərini yerinə yetirərkən Allaha minnət etmə kimi bir hissə qapanmamalıdır. Qula yaraşan Rəbbini bu şəkildə tanıması, Ona möhtac olduğunu xatırından çıxarmaması və bütün ehtityaclarında Ona yönəlməsidir. Allah zəngindir. Onun heç bir şeyə ehtiyacı yoxdur. Ondan başqa hər şey Ona möhtacdır. Onun rəhmi və mərhəməti olmadan bir kimsənin yaxlşılıq etməsi və bu yaxşılıqda zirvəyə qalxması mümkün deyildir. Eyni

---

[236] Buxari, Müslim.
[237] Müslim 2699.
[238] Müslim 2590.

şəkildə Onun ədaləti və hikməti olmadan bir kimsənin pislik etməsi və bu pislikdə zirvəyə çatması mümkün deyildir.

## ĞALİB

***əl-Ğalib* – *«Allah öz işində*** *(əmrində)* ***Qalib olandır*** *(istədiyini edəndir)****».*** *(Yusif 21).* ***Ğalib*** – Allahın feli sifətlərindəndir. Allahın qalib gəlməsi dilədiyi kimsəyə qadir olması, gücü çatması və onu dilədiyi şəkildə yaxalaması deməkdir. Heç şübhə yox ki, Allahı məğlub etmək istəyən kəsinliklə yeniləcəkdir. Hər müsəlman Allahın mütləq qalib olduğunu bilməli və hər işində yalnız Ona arxalanmalıdır. Səmimiyyətlə Qalib olana arxayın olan kimsəyə qarşı bütün yer üzündəkilər belə əleyhinə olsalar sonunda o, qalib gələcəkdir. ***«And olsun ki, Mən və Peyğəmbəri qalib gələcəyik…».*** *(əl-Mucadələ 21).* Allahdan üz çevirərək başqalarına arxayın olanlar mütləq məğlub olacaqlar. ***«Şeytanın dostlarıyla vuruşun! Şübhəsiz ki, şeytanın hiyləsi zəifdir!».*** *(ən-Nisa 76).*

## QĀDİR - QADİR – MUQTƏDİR

***əl-Qādir – əl-Qadir – əl-Muqtədir – «Elə isə O, Allah ölüləri diriltməyə qadir deyilmi?».*** *(əl-Qiyamə 40).* ***«Allah hər şeyə qadirdir».*** *(əl-Bəqərə 20).* ***«Haqq məclisində, qadir hökmüdar*** *(MUQTƏDİR)* ***Allahın hüzurunda olacaqlar».*** *(əl-Qəmər 55).* ***"De: "Allah başınızın üstündən və ayaqlarınızın altından*** *(göydən və yerdən)* ***sizə əzab göndərməyə, sizi dəstələr halında qarışdırmağa və birinizə digərinizin zorunu daddırmağa qadirdir!" Gör ayələrimizi onlara nə cür izah edirik ki, bəlkə, başa düşsünlər!".*** *(əl-Ənam 65).* Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «Bu isimlər heç bir şeyin Allahı aciz edə bilməyəcəyinə dəlildir. O, dilədiyini edəndir. Heç kimsə Ona mane ola bilməz». ***«Məgər onlar göyləri və yeri yaratmış və onları yaratmaqdan yorulmamış Allahın ölüləri də diriltməyə qadir olduğunu görüb anlamazlarmı?».*** *(əl-Əhqaf 33).* ***«Allah hər şeyə qadirdir!».*** *(əl-Kəhf 45).* Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «***Muqtədir*** – gücü və qüvvəti tam olandır. Belə heç bir şey Onun gücünə qarşı dura bilməz. Ona mane ola bilməz. Heç bir güc Onu aciz edə bilməz. Qadir, Qədirdən daha əhatəli olub mütləqiyyət ifadə edər».

Qādir, Qadir və Muqtədir güc və qüdrət sahibi deməkdir. Qādir – üçün bir şeyi dilədiyindən edən və ya etməyəndir. Qaadir üçün diləmək bir şeyi etmək üçün mütləq olması vacib olan bir şərt deyildir. Allah qiyaməti bu an da etməyə qadirdir. Əgər O, Bunu diləyərsə edə bilər. Lakin qiyaməti bu an etmədiyinə görə Allah bunu bu an üçün diləməməkdədir. Allahın əzəli elmi ilə qiyamət üçün müəyyən bir vaxt müəyyənləşdirməsi Onun güc və qüdrətində bir qüsur olduğunu göstərməz.

Mütləq Qādir hər varlığı tək başına və diləməsi ilə heç kimsədən kömək almadan yoxdan var edəndir. Bu da ancaq Allah üçün keçərlidir. Qul da bəzi şeylər etməyə qadirdi. Lakin onun qüdrəti olduqca naqisdir (azdır). O, bu gücünü sadəcə varlığı mümkün olan bəzi şeylər üzərində göstərə bilər. Uca Allah kimi bir şeyi yoxdan var edə bilməz. Yoxdan var etmə özəlliyi yalnız Allaha məxsusdur. Qullarının gücünü də yaradan Odur. Allah qüdrət sahibi olduğuna görə dilədiyinə hidayət verir, dilədiyi kimsələri də sapdırır. İnanclını inanclı, inkarçını inkarçı, yaxşını da yaxşı, pisi də pis edən Odur. İbrahim – *əleyhissəlam* – və ailəsini inanclı edərək insanları Ona dəvət

edən və onun əmri ilə hidayət yolunu göstərən və Firon və qövmünü inkarçı edərək insanları Cəhənnəmə çağıran dəvətçilər edən Odur.

Allah göyləri, yeri və ikisi arasında olanları altı gündə yaratmış və Ona heç bir yorğunluq da gəlməmişdir. Varlıqlardan heç birisi Onu aciz edə bilməz. Allah heç bir şeyə möhtac deyildir. Buna görə də Ona şərik qoşmaq. Övlad isnad etmək, Onun izni olmadan şəfaətçilər olduğunu söyləmək mümkün deyildir. onun sözləri tükənməz və dəyişdirilməz. Əgər bütün dənizlər və yeddi misli qədər dəniz mürəkkəb olsaydı, bütün ağaclar da qələm olsa və bu qələm və mürəkkəblərlə sözlər yazılsa, mürəkkəblər tükənər, qələmlər qurtarardı. Amma Onun sözləri tükənməz və qurtarmazdı. Çünki sözlər yaradılanlar kimi deyildir. Yaradılan mürəkkəb və qələmin tükənməməsi və qurtarmaması mümkün deyildir. Bəzilərinin iddia etdikləri kimi Allahın sözləri yaradılmış (məxluq) deyildir. Bunu iddia edənlər Allahı layiqincə qiymətləndirməyənlərdir. Buna görə də iddiaları qələm və mürəkkəbdən də daha tez yox olur. Əgər Allahın sözləri yaradılmış olsaydı onlar da digər məxluqlar kimi yox olurdular. Allahın sözləri əbədi, digərləri isə fanidir. Allah heç kimsəni günah etmədən və ya başqasının etdiyi bir günaha görə cəzalandırmaz. Həmçinin də Allah bir kimsənin gücü çatmadığı şeyləri tərk etməsi və tərk etməsi mümkün olmayan şeyləri etdiyinə görə cəzalandırmaz. Ondan daha çox üzürləri qəbul edən və ehsan edən yoxdur. O, Muhsindir, ehsan edənləri sevər, Şəkurdur, şükr edənləri sevər, Cəmildir, gözəlliyi sevər, Tayyibdir, gözəl və xoş olanı sevər, Alimdir, biliyli qullarını sevər, Kərimdir, ikram edən qullarını sevər, Adildir, ədalətli olanları sevər, Bərrdir, yaxşı olanları sevər, Sadiqdir, doğru olanları sevər, Rəfiqdir, yumşaqlığı sevər, Rəhimdir, mərhəmətli olanları sevər, Vitrdir, tək olanı sevər. Allah öz İsim və Sifətlərinin hər birini sevir. Bu İsim və Sifətlərlə Ona ibadət edən, bunlarla istəyən, dua edənləri sevər. Allah bu İsim və Sifətləri bilən, mənalarını başa düşən, bunlarla Allahı tərif edənləri də sevər. İbn Məsud – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allahdan daha qısqanc bir kəs yoxdur. Allah bu qısqanclığına görə açıq və gizli olan bütün çirkin əməlləri haram etmişdir. Təriflənməyi Allahdan daha çox sevən bir kimsə yoxdur. Buna görə Uca Allah Öz nəfsini tərifləmişdir. Allahdan daha çox dəlil sevən yoxdur. Bax, bunun üçün də bir çox müjdələyən və qorxudan Peyğəmbərlər göndərmişdir (Başqa rəvayətdə: Bax buna görə də Allah Peyğəmbərlərini göndərmiş və kitablarını endirmişdir)[239]. Allah İsim və Sifətlərini sevdiyi üçün qullarına da bu İsim və Sifətlərlə əməl etməyi əmr etmişdir. Buna görə də qullarına ədaləti, ehsanı, mərhəməti, səbri, doğruluğu, elmi, şükrü, bağışlamağı əmr etmişdir. Allah bu İsim və Sifətləri sevdiyi üçün, insanlar arasında ən çox bu İsim və Sifətlərə sahib olmağa çılışanları da sevər. Sevmədiyi sifətlərə sahib olan və bu sifətlərə sahib olmağa çalışanları da sevməz. Allah təkəbbürlü, başqalarına xor baxan, ələ salan, haqsızlıq edənləri necə sevsin? Bu sifətlərə sahib olmaq ən böyük zülmdür. Buna görə də bu sifətlərin heç biri Allaha yaraşmaz. Allah bu cür sifətlərdən uzaqdır. Gözəl olmayan bir İsim Onda ola bilməz. Daima ən gözəl İsimlərlə isimləndirilir.

## QAHİR – QAHHAR

***əl-Qahir - əl-Qahhar – «O, hər şeyə Qahhar olan tək bir Tanrıdır».*** *(ər-Rəd 16).* ***«O, öz qulları üzərində Qahir olandır».*** *(əl-Ənam 18).* ***«…Hər şeyə Qadir və Qahhar***

---

[239] Buxari 7416, Müslim 1499.

***olan bir Allah?».*** *(Yusuf 39).* Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «***Qahir –*** qullarının işlərini dilədiyi şəkildə düzüb-qoşan, idarə edən, onların üzərində hakimi mütləq olandır. Qahhar – isə heç bir şəkildə məğlub edilməyən və üstün gəlinməyəndir». Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «***Qahir –*** canlılar arasında həddini aşanları əzab ilə digər bütün məxluqatı isə ölümlə yox edəndir». Mülkün, güc və qüvvətin, yüksəkliyin tamamı tək və qahhar olan Allaha aiddir. Ondan başqa hər şey məğlub və acizdir. Bütün hər şeyin ziddi, ortağı vardır. Yalnız Onun ziddi və ortağı yoxdur. Allah göy və yer əhlini özünə boyun əydirmişdir. Göy əhlini özünə xidmət etməklə, yer əhlini də Ona ibadət və itaət etməklə boyun əydirmişdir. Zalım və zorbaların belini qıran, üsyankar və həddi aşanların boyunlarını bükən, dünyadakı əməllərinə qovuşmağlarına mane olan Allahdır. Uşaq sahibi olmaq istədiyi halda olmayan, qocalmaq istəmədiyi halda qocalan, güclü və üstün olmaq istədiyi halda zillətdən qurtarmayan, zəngin olmaq istədiyi halda miskinləşən kimsələrin istəklərini Allahın diləməsi ilə həyata keçməməkdədir. Onların iradəsi heç bir zaman Allahın iradəsinin önünə keçməz və onu aşmaz. Allahın istək və iradəsi daima onların istəklərinin üstündədir. Bütün varlılıqlar Allahın diləməsi və hökmü altındadırlar. Onun izzəti altında əzilməyən, sonsuz gücünə boyun əyməyən heç bir şey yoxdur. Varlılıqların dilək və istəkləri Onun diləməsi altındadır. ***«Allah istəmədikcə siz istəyə bilməzsiniz».*** *(İnsan 30).*

## QUDDUS

***əl-Quddus*** – təmiz, heç bir ləkəsi olmayan, bütün nöqsan və qüsurlardan münəzzəh olan, hər hansı bir nöqsanı qəbul etməyən, fəzilət və gözəl sifətlərdən dolayı öyülən. ***«O, Allah ki, Ondan başqa ilah yoxdur. O, Məlikdir, Quddusdur, Səlamdır…».*** *(əl-Həşr 23).* O, zatına yaraşmayan hər şeydən münəzzəhdir. Bütün vəsflərdə ən mükəmməl, təhdid və təsvirə sığmayan, öyülməyə layiq fəzilət və gözəllik sifətləri özündə olandır. Bu İsim Qurani Kərimdə **2** yerdə keçməkdədir. Məlik ismi ilə birlikdə işlədilmişdir[240]. Qurtubi – *rahmətullahi aleyhi* – deyir ki: «***Quddus –*** hər cür əskiklik və nöqsanlardan uzaq olan, hər cür qüsurdan təmiz olan deməkdir». Ayrıca bir yerdə də Allahın mələklərə insan nəslini yaradacağını bildirdikdə onların verdiyi cavabda ***Nuqaddisu*** – zikr edilməkdədir. ***«Biz Sənə şükr etdiyimiz, şəninə təriflər dediyimiz və Səni müqəddəs tutduğumuz halda…».*** *(əl-Bəqərə 30).* Allahın bu İsmi Onun təşbih və təcsimdən bir başqa şeyə bənzəməkdən, bəşəri sifətlərdən münəzzəh olduğunu ifadə etməkdədir. İbn Cərir – *rahmətullahi aleyhi* – deyir ki: «İnkar edənlərin Sənə izafə etdikləri hər cür pislikdən Səni tənzih edirəm, bütün gözəl və təmiz sifətlərin səndə olduğunu qəbul edirəm. Səni zikr edir və ucaldıram». Bu ayədə mələklər Allahı tənzih etməkdə və təqdis etməkdədirlər. Ayədə təsbih və təqdis yan-yana zikr edilmişdir.

Bu kəlimənin əsli təharət və nəzarətdən gəlməkdədir. ***Beytul-Məqdis*** – bu kəlimədən alınmışdır. Çünki orası pak və təmiz olan bir yerdir. Yenə Cənnət təmiz bir yer olduğuna görə ***Haziratul-Quds***, Cəbrail – *əleyhissəlam* – ***Ruhul-Quds*** – deyə isimləndirilmişdir. ***Subhənəallah*** – Uca Allahı bütün pisliklərdən tənzih etmək.

Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «***Quddus –*** bütün gözəl təriflərlə təriflənən, mədh edilən deməkdir. Allahı təqdis edib, təsbih etmək. Allahdan pis sifətləri nəfy etmək, Onun gözəl sifətlərə sahib olduğunu qəbul etmək. Necə ki, Onun şəriki və

---

[240] Bax: Həşr 23, Cumə 1.

bənzəri yoxdur dediyimizdə Allahın bir və tək olduğunu isbat edər. Eyni şəkildə heç bir şey Onu aciz etməz dediyimizdə, Onun güclü və hər şeyə gücü çatan Qadir olduğunu, heç kimsəyə zülm etməz dediyimizdə, Onun bütün hökmlərində və fellərində Adil olduğunu qəbul etməyi isbat edər. Digər tərəfdən də Allahın gözəl sifətlərini qəbul etmək, pis sifətlərin Onda olmadığı mənasına gəlir».

# QARİB – MUCİB

***əl-Qarib* – *«Həqiqətən O, eşidən və*** *(QARİB dua edən bəndələrinə)* ***yaxındır».*** *(əs-Səba 50). «(Ya Muhəmməd!)* ***Bəndələrim Məni səndən soruşduqda söylə ki, Mən onlara yaxınam*** *(QARİB)* ***mənə dua etdiyi zaman dua edənin duasına cavab verərəm…».*** *(əl-Bəqərə 186).* Əbu Musa – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə birlikdə səfərlərin birində idik. İnsanlar təkbir gətirərək səslərini ucaltmağa başladılar. Peyğəmbər: «Ey insanlar! Nəfslərinizə sahib olun. Çünki sizlər eşitməyən və uzaqda olan birini səsləmirsiniz. Heç şübhəsiz ki, sizlər ən yaxşı eşidən və sizə yaxın olan Səmi, Qarib olan Allaha dua edirsiniz. Halbuki o, hər zaman sizinlə bərabərdir» deyə buyurdu . Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «***Qarib*** – yaxın olan, qul ilə Rəbbi arasında bir məsafə olmadığı mənasına gəlir. Bu üzdən qulun durumu Ondan gizli deyildir. O, qulun etdiyi hər bir duanı eşidir. Allahın yaxınlığı müəyyən bir məsafəni ifadə etməz. Çünki məsafə müəyyən bir sərhədə qədərdir. Allah üçün isə sərhəd yoxdur». Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «***Qarib*** – bütün varlıqlara elimi ilə, dua edənlərə də duaları qəbul etməklə yaxındır».

Allahın qullarına yaxın olması iki cürdür. **1.** ***Ümumi Yaxınlıq*** – Allahın hər bir şeyə elmi ilə yaxın olması. Onları bilməsidir. O, insanlara şah damarlarından da belə yaxındır. **2.** ***Xüsusi Yaxınlıq*** – Ona dua edən və Onu sevənlərə göstərdiyi yaxınlıqdır. Bu cür yaxınlıq sevgini, yardımı və dəstəyi əhatə edir. Allah dua və ibadət edənlərin dualarını və ibadətlərini qəbul edər.

***əl-Mucib*** – Cavab verən deməkdir. ***«Həqiqətən Nuh bizə dua etmiş, onun duası necə də gözəl*** *(MUCİB)* ***qəbul olunmuşdur».*** *(əs-Saffət 75).* ***«Həqiqətən Rəbbim yaxındır və*** *(duaları MUCİB)* ***qəbul edəndir».*** *(Hud 61).* ***«Yaxud əli hər yerdən üzülüb darda qalan bir kimsə Ona dua etdiyi zaman duasını qəbul edən…».*** *(ən-Nəml 62).* ***«Mənə dua edin Mən də sizin dualarınızı qəbul edim».*** *(əl-Mumin 60).* Bəzən də Qurani Kərimdə kəsmək, biçmək, oymaq mənasında da gəlir. ***«Və vadilərdə qayaları oyub-biçən Səmuda».*** *(əl-Fəcr 9).* Qurtubi – *rahmətullahi aleyhi* – deyir ki: «Mucib – kəsən mənasındadır. Yəni dua edənin arasını qəbul edərək kəsəndir. Buna görə də dua edənin duasını həmən qəbul edən və imdadına yetişəndir». Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «Bu isim Qarib ismilə birlikdə zikr edilir. ***Qaribul-Mucib*** və ***Mucibud-Dua*** (duaları qəbul edən) deyilir. ***Mucibu Davətəl Muttarrin*** (çarəsizlərin dualarını qəbul edən), istəyənə istədiyini verən deməkdir. Allahdan başqa kimsənin buna gücü çatmaz».

Bunu da bilin ki, duaların qəbul edilməsi bir neçə şərtlərə bağlıdır. Bu şərtlərin bir qismi dua edənin durumu ilə, bir qismi dua edilənlə, bir qismi də istənilən şeylə, bir qismi də zaman və məkanla bağlıdır. Duanın qəbul edilməsinə mane olan şeylər isə sayılmayacaq qədər çoxdur.

---

[241] Buxari 2992, Müslim 2704.

***Duanın Ədəbləri Və Qəbul Olunma Səbəbləri:*** 1) Allaha ixlasla dua etmək. Numan b. Bəşir – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dua ibadətdir» . 2) Duaya Allaha həmd-səna etməklə və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə salavat gətirməklə başlamaq və elə bu cür də duanı bitirmək. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah Ona dua etməyənə qəzəblənir» . ***«Allahın elçisini öz aranızda bir-birinizi çağırdığınız kimi çağırmayın». (ən-Nur 63).*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim mənə bir dəfə salavat gətirərsə Allah o, kimsəyə on dəfə salavat deyər» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qəbrimi bayram edilən yerə çevirməyin. Mənə salavat gətirin. Harda olsanız sizin salavatınız mənə çatacaqdır» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həqiqətən də yer üzündə Allahın mələkləri vardır ki, mənim ümmətimin mənə göndərdikləri salavatı mənə çatdırırlar» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mənə salavat deyəndə Allah mənə ruh verir ki, mən də o, kimsəyə salam deyim» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ya Əli! Ən xəsis insan bilirsənmi kimdir?». Əli: «Allah və Rəsulu daha gözəl bilir» dedi. Peyğəmbər: «Mənim adım çəkiləndə mənə salavat gətirməyən kimsədir» deyə buyurdu . Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bir gün minbərə çıxdı və: «Amin! Amin! Amin!» deyə buyurdu. Səhabələr: «Bu nədir ya Rəsulullah!» deyə soruşdular. Peyğəmbər: «Cəbrail mənə gələrək dedi: «Qoy utansın (burnu yerlə sürtünsün) o, kimsə ki, sənin adın çəkildiyi vaxt sənə salavat gətirməyən» . 3) Duada qətiyyət göstərmək və onun qəbul olunmasına yəqin olmaq. 4) Duada israrlılıq və tələsməmək. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yer üzündə elə bir müsəlman yoxdur ki, Allahdan istəsin və Allah da ona verməsin və ya (dua vasitəsi ilə onu qarşıda gözləyən) bəladan onu xilas etməsin. Lakin o, Allahın haram etdiyi şeyləri və qohumluq əlaqələrinin kəsilməsini istəməməlidir. Həmçinin də (duasının tez qəbul olunması üçün) tələsərək deməməlidir ki: «Mən dua etdim lakin mənə cavab verilmədi» . 5) Ürəkdən dua etmək. 6) Hər bir vəziyyətdə dua etmək (həm sevindirici, həm də çətin). 7) Yalnız tək Allahdan istəmək. 8) Ailəyə, mal-dövlətə, övlada və özünə bəd dua etməmək. 9) Alçaq səslə dua etmək. 10) Günahı etiraf etmək və onun bağışlanmasını diləmək, neməti etiraf etmək və bunun üçün də Allaha şükr etmək. 11) Duada qafiyədən istifadə etməmək. 12) Yalvarış, itaətkarlıq, rəğbət və qorxu ilə dua etmək. 13) Tövbə etməklə zülm və izdirabların rədd etmək. 14) Duada istənilən şeyi üç dəfə təkrar etmək. 15). Qiblə istiqamətində dayanmaq. 16) Dua edilən an əlləri qaldırmaq. 17) Duadan qabaq dəstəmaz almaq. 18) Təcavüz və düşmənçilik istənilməməlidir. 19) Dua edən başqasına dua etdiyi təqdirdə öncə özündən başlamalıdır. 20) Dua edərkən Allahın gözəl isimlərini və sifətlərini, yaxud dua edənin özünün gördüyü saleh bir əməli, yaxud da dua edən şəxsin əli çatdığı əməli saleh, diri bir insanın duasını vasitə götürmək olar. 21) Dua edənin yeməyi, içkisi və geyimi halal

---

[242] Əbu Davud, Tirmizi.
[243] Buxari, Əhməd, Tirmizi.
[244] Müslim.
[245] Əbu Davud, Əhməd.
[246] Nəsai.
[247] Əbu Davud.
[248] Tirmizi.
[249] Buxari, Müslim.
[250] Tirmizi.

olmalıdır. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «…Saçı-saqqalı bir birinə qarışmış, üst-başı toza bulaşmış halda uzun səfər etmiş, yediyi haram, içdiyi haram və haram ilə bəslənən birisini xatırladaraq, bu kişi əllərini səmaya qaldıraraq ya Rəbbim, ya Rəbbim deyə dua etsə, necə ola bilər ki, onun duası qəbul olunsun» . 22) Dua edilərkən hər hansı bir günahın edilməsi və ya qohumluq əlaqələrinin kəsilməsi kimi diləklərə yol verilməməlidir. 23) Yaxşı işləri əmr, pis işləri isə qadağan etmək. 24) Bütün günahlardan uzaq olmaq.

***Duanın Qəbul Olunması Üçün Müəyyən Vaxt Və Yerlər:*** 1) Qədr gecəsi. 2) Gecənin son üçdə biri. 3) Fərz namazlarının ardıyca. 4) Azanla iqamə arası. «Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Azan və iqamə arasında dua rədd edilməz» . 5) Hər bir gecədə istənilən vaxtda. 6) Fərz namazlarına çağırış vaxtı. 6) Yağış yağanda. 7) Cümə günü (Əsr namazının sonuna yaxın bir vaxdır, bəzi rəylərə görə də cümə günü xütbə və namaz vaxtlarında da ola bilər). 8). Zəm-zəm suyunu içdikdə. 9) Səcdədə. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Qulun öz Rəbbinə ən yaxın olan vaxtı səcdədir. Buna görə də səcdə də Allaha çox dua edin (Başqa rəvayətdə: Siz cavab almağa layiqsiniz)» . 10) Gecə yuxudan ayılan zaman. Əbu Umamə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* -dən: «Hansı duaya daha tez cavab verili» deyə soruşdular. Peyğəmbər: «Gecə yarısı və hər fərz namazından sonra edilən dua» deyə buyurdu. 11) Təharətli vəziyyətdə yatıb, gecə yuxudan ayılaraq dua etdikdə. 12) İnsanların cənazə üçün duaları. 13) Sonuncu təşəhüddə salavatdan sonra edilə dua. 14) Dua etdikdə qəbul olunan və istədikdə verilən Allahın əzəmətli adı ilə. 15) Müsəlmanın qardaşı üçün gizlində etdiyi dua. 16) Ərafət dağında dua. 17) Ramazan ayında. 18) Müsibət baş verdikdə. 19) Allaha ixlasla dua etdikdə. 20). Məzlumun bəd duası. 21). Atanın övlada etdiyi xeyir-duası və bəd duası. 22). Müsafirin duası. 23) Oruclunun iftaradək etdiyi dua. 23) Oruclunun iftar zamanı etdiyi dua. 24). Məcburiyyət qarşısında qalan şəxsin duası. 25) Ədalətli rəhbərin duası. 26) Xeyirxah övladın valideyinə etdiyi dua. 27) Dəstəmaz aldıqdan sonra müvafiq dua ilə dua etmək. 28) Kiçik cəmrəyə daş atdıqda. 29) Orta cəmrəyə daş atdıqda. 30). Kəbənin içərisində edilən dua. Kim Hicrin içində namaz qılsa o, Kəbədə namaz qılmış hesab olunur . 31) Səfa və Mərva təpələri üstündə. 32) Məşərülhəram . ***«Rəbbinin camalını diləyərək səhər-axşam ona dua edənləri yanından qovma. Onların əməllərinin sənə, sənin əməllərinin isə onlara heç bir dəxli yoxdur. Buna görə də zalimlərdən olarsan».*** *(əl-Ənam 52).* Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «əl-Mufarridunə qabaqladılar». Səhabələr: «Bunlar kimlərdir ya Rəsulullah?» deyə soruşdular. Peyğəmbər: «Allahı çox zikr edən kişi və qadınlar» .

---

[251] Müslim 1015.
[252] Əbu Davud, Tirmizi.
[253] Müslim.
[254] Kəbənin şimal-qərbində yerləşən bir yer.
[255] Həcc mərasimində Ərafət dağında günbatan zamanı Zəvvarların olduğu yer.
[256] Müslim.

# QAVİ - MƏTİN

***əl-Qavi* – *əl-Mətin* – «Şübhəsiz Allah** *(QAVİ)* **güc sahibi və Azizdir».** *(əl-Həcc 74).* **«Allah yenilməz qüvvət sahibidir** *(QAVİ)* **və cəzası da çox şiddətlidir** *(ŞƏDİDUL İQAB)***».** *(əl-Ənfal 52).* **«Heç şübhəsiz ki, ruzi verən,** *(MƏTİN)* **yenilməz qüvvət sahibi olan Allahdır».** *(əz-Zariyyət 58).* Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «***Qavi*** **–** tam və mütləq güc sahibi olduğudur. Allahdan başqa bütün varlılıqlar nə qədər də güc sahibi olsalar da onların gücü müəyyən bir hədd çərçivəsinə qədərdir. Bir çox şeylərə gücləri çatmaz». Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «***Mətin*** **–** güc və qüvvəti azalmayan və gücdən düşməyəndir. Bu yalnız Allaha xasdır. Ondan başqa bütün varlılıqlar vaxt gəldikcə güclərini itirərək zəifləyirlər. Bu isə Allah üçün imkansız, varlılıqlar üçün isə mümkündür». Allahın güc və qüvvət sahibi olduğunu bilən müsəlman öz güc və qüvvəti ilə lovğalanmağı tərk edər. Uca güc sahibinə yönələr.

# LƏTİF

***əl-Lətif*** **–** Ən çətin işləri belə bütün incəlikləri ilə bilən və varlıqlara nemətlərini gizli yollarla, yumşaqlıqla onlara çatdırıb ehtiyaclarını qarşılayandır. Bir işi etmək xüsusunda yumşaq olmağı və faydalı şeyləri yaratdıqlarından dilədiyinə gözəlliklə və incəliklə çatdırmaqda işlərin ən incə və ən gizli yönlərini özündə toplayan zat deməkdir. ***«O, Lətifdir».*** *(əl-Ənam 103).* ***«Allah qullarına çox lütfkardır».*** *(əş-Şura 19).* ***«Doğrusu Rəbbim dilədiyinə lütfünü ehsan edər».*** *(Yusuf 100).* Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «***Lətif*** - bilmədikləri yöndən qullarına lütf və yaxşılıq edən, onlara düşünmədikləri yerdən xeyirlər verəndir. ***«Allah qullarına qarşı lütf sahibidir, dilədiyini ruziləndirir».*** *(əş-Şura 19).* Allah sənə lütf etdi.

1. İbn Abbas – *radıyallahu anhu* – deyir ki: ***«Allah qullarına qarşı lütf sahibidir»*** – ayəsində: «Onlara qarşı xoş və gözəl davranandır» deyə açıqlamışdır. 2. Onlara yaxşılıq edəndir. 3. Yaxşı kimsəyə də, pis kimsəyə də yaxşılıq edəndir. Üsyan etmələrinə baxmayaraq onları aclıqdan öldürməz. 4. Qullarına yumşaq davranandır. 5. Ruzi verməkdə qullarına iki yöndən yaxşılıq edəndir. Birincisi onları gözəl şeylərlə ruziləndirir, ikincisi isə ruzilərini bir dəfədə verməyərək israf etmələrinə mane olandır. 6. İnsanlar arasında qullarının yaxşılıqlarını yayan, pisliklərini isə örtəndir. 7. Azı qəbul edib, çoxu isə verəndir. 8. Qullarına çalışmasından daha artığını verən və ona gücündən artığını yükləməyəndir. 9. Ona üsyan edəni cəzalandırmaqda tələsməyən, ümüd edənin də ümüdünü boşa çıxarmayandır. 10. Dininə xidmət edənə yardım edən və çox tərif edəndir. 11. İstəyəni geri çevirməyən, ümüd edəni ümüdsüz qoymayandır. 12. Xətaları bağışlayandır. 13. Öz nəfsinə acımayana acıyandır və s .

# FATİR

***əl-Fatir*** **–** ***«Həmd göyləri və yeri yaradan Allahındır».*** *(Fatir 1).* Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ey göyləri və yeri yaradan Allahım!». Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «***Fatir*** **–** yeri və göyü bir-birindən ayıran, yarandır. ***«Kafir olanlar göylə yer bitişik ikən Bizim onları ayırdığımızı*** *(yardığımızı)****, hər bir canlını sudan yaratdığımızı bilmirlərmi?».*** *(əl-Ənbiya 30).* Allah göyləri yağmurla,

---

[257] Qurtubi 1/333-336.

yerləri də bitkilərlə yarmışdır. ***«Sizi yaratmaq çətindir. Yoxsa göyü ki, Allah onu yaratdı. Qübbəsini ucaltdı, düzəldib nizama saldı, gecəsini qaranlıq, gündüzünü işıqlı etdi. Bundan sonra da yeri döşəyib düzəltdi. Ondan suyunu və otlağını çıxartdı. Dağları yerləşdirdi».*** *(ən-Naziət 27-32).* Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «***Fatir*** **–** varlılıqları yaradandır. Yəni onları yoxdan var edəndir. Bu ayədə bu mənadadır. ***«Bizi kim*** *(bu həyata)* ***qaytara bilər deyəcəklər. De ki: «Sizi ilk dəfə yaradan».*** *(əl-İsra 51).* İbn Abbas – *radıyallahu anhu* – deyir ki: «Mən göylərin və yerin Fatirinin nə məna ifadə etdiyini bilmirdim. İki bədəvi bir quyunun yanında mübhisə edərkən biri: «Mən bunun fatiriyəm» dedikdə mənasını başa düşdüm. Bədəvi bu sözü ilə quyunun özü düzəltdiyini qəsd edirdi» .

# FƏTTƏH

***əl-Fəttəh – «Sənin Rəbbin*** *(hökmünü verərək haqq ilə batilin arasını açandır)* ***və biləndir».*** *(Səbə 21).* Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «***Fəttəh*** **–** hökm verəndir. Allah verdiyi hökmlərlə qulları arasında qıfıllanan sorğu-sualları və haqq ilə batilin arasını açan, haqlını ucaldıb haqsızı alçaldandır. Bu dünyada ola bildiyi kimi axirətdə də ola bilir». Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «***Fəttəh*** **–** açan deməkdir. Allah qullarına mərhəmət və ruzi qapılarını açan, qıfıllanan işlərini açan, haqqı görmələri üçün qəlblərini və gözlərini açan deməkdir. Fatih yardım edən mənasına da gəlir. ***«Əgər fəth istəyirsinizsə, indi sizə fəth gəldi…».*** *(əl-Ənfal 19).*

Hər bir müsəlman kəsin bir şəkildə Allahdan başqa qullar arasında hökm edən və haqq ilə batilin arasını açan olmadığına inanmalıdır. Allahdan başqa Hakim olmadığına inanmalı və Onun hökmündən başqa hökm qəbul etməməlidir. ***«Allahdan başqa bir hakimmi axtarırsınız? O, isə sizə kitabı açıqlamış olaraq endirmişdir».*** *(əl-Ənam 114).* ***«Kim Allahın nazil etdiyi ilə hökm etməzsə onlar kafir olanlardır».*** *(əl-Maidə 44).* ***«Kim Allahın nazil etdiyi ilə hökm etməzsə onlar zalım olanlardır».*** *(əl-Maidə 45).* ***«Kim Allahın nazil etdiyi ilə hökm etməzsə onlar fasiq olanlardır».*** *(əl-Maidə 47).* ***«Onlar Cahiliyyət dövrünün hökmünümü istəyirlər? Tam qənaət sahibi olan bir cəmaat üçün Allahdan daha yaxşı hökm verə bilən kimdir».*** *(əl-Maidə 50).* Müsəlman Allahın hökmünü və bu hökmü qəbul etməli və ona boyun əyməlidir. ***«Allaha və Peyğəmbərə iman gətirdik, itaət etdik – deyər. Bundan sonra isə onlardan bir dəstə*** *(Peyğəmbərdən)* ***üz çevirər. Beləlləri mömin deyillər. Aralarında hökm etmək üçün Allahın və peyğəmbərin yanına çağırıldıqda onlardan bir dəstə dərhal üz çevirər. Əgər haqq onların tərəfində olsa itaət edib*** *(tez)* ***onun yanına gələrlər. Onların qəlblərində xəstəlikmi vardır? Yaxud Allahın və Peyğəmbərinin onlara cövr, haqsızlıq edəcəklərindən qorxurlar? Xeyr, onlar özləri zülmkardılar! Aralarında hökm vermək üçün Allahın və Peyğəmbərinin yanına çağırıldıqları zaman möminlərin sözü ancaq: «Eşitdik və itaət etdik! Deməkdən ibarətdir. Nicat tapanlar da məhz onlardır! Allaha və Onun Peyğəmbərinə itaət edənlər Allahdan qorxub çəkinənlər məhz beləlri uğura çatanlardır».*** *(ən-Nur 47-52).*

Müsəlman qapalı olan hər şeyi ancaq Allahın açabiləcəyini bilməlidir. Qullarına ruzi və mərhəmət qapılarını açan, çətin və bağlı işləri açan, haqqı görmələri üçün qəlblərini və gözlərini açan, sıxıntı və darlıqdan sonra könüllərini açıb sevinc verən Odur. Köksləri İslama açan, qeyb qapılarını açan da Odur. Allah sənə elm, ruzi qapıları

---

[258] Beyhəqi s. 26,27.

açdığı kimi sən də elmin açarı ilə cahil və biliksiz kimsələrin qapalı qəlblərini aç və onların könüllərini fəth et, sənə verilən ruzidən insanlar üçün də xərclə və qorxma ki, malından əskilər. Əksinə malına daha da bərəkət verilər. ***«Allah sənə ehsan etdiyi kimi sən də ehsan et».*** *(əl-Qəsəs 77).*

## KƏFİ – KƏFİL

***əl-Kəfi* – *«Məgər Allah öz bəndəsinə kifayət*** *(KƏFİ)* ***deyilmi?».*** *(əz-Zumər 36).* Ənəs b. Məlik – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yatağına girdiyin zaman ***Əlhəmdulilləhil Ləzi Ətamənə Və Səqanə Və Kəfənə Və Əvənə Fəkəm Mimmə Lə Kəfiyyə Vələ Muviyə –*** Bizi yedirdən, içirdən, qoruyan (ehtiyaclarımızı qarşılayan) və barındıran Allaha həmd olsun. Neçə qoruyanı (ehtiyacları qarşılanmayan) və barındıranı olmayan kimsələr vardır» . Bütün varlılıqların ehtiyaclarını qarşılayan Allahdır. Bu işdə də Onun şəriki və bənzəri yoxdur. Bütün ehtiyaclar yalnız Onun tərəfindən qarşılanır. Buna görə də yalnız Ona ibadət etmək, Ona yönəlmək və Ona ümüd etmək lazımdır.

***əl-Kəfil* – *«Əhd etdiyiniz zaman Allaha verdiyiniz əhdi*** *(KƏFİL)* ***yerinə yetirin. Allahı özünüzə zamin edib möhkəm and içdikdən sonra onu pozmayın. Həqiqətən Allah nə etdiklərinizi bilir».*** *(ən-Nəhl 91).* Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kəfil olaraq Allah ona yetər» . İnsanların dini və dünyavi ehtiyaclarını qarşılamayı üzərinə alan Allah həqiqi Kəfildir. Buna görə də çalışan bir kimsənin əməlini boş etməyəcəyini biə xəbər verir. ***«Şübhəsiz ki, Mən kişi olsun, qadın olsun sizdən bir əməl edənin əməlini boşa çıxarmaram».*** *(Ali İmran 195).*

Müsəlman bu İsimləri gözəl mənalarını bildikdən sonra özü də başqa insanların, əlaxüsus da müsəlmanların üzüntülərini, sıxıntılı olan qohum-əqraba və dostlarının sıxıntılarını qaldırmağa çalışmalıdır. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər kim bir mömini dünya sıxıntılarının birindən qurtararsa, Allah onu Qiyamət gününün sıxıntılarının bir sıxıntısından qurtarar. Hər kim çətinliyə düşənin çətinliyini yüngülləşdirərsə, Allah da o, kimsəyə dünya və axirətdə asanlıq, yüngüllük verər. Qul öz qardaşına kömək etməyə davam etdikcə, Allah da ona kömək etməyə davam edər…» . Əbu Qatadə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim istəyirsəki Allah onu Qiyamət gününün əzabından qurtarsın qoy çətinliyə düşənin çətinliyini yüngülləşdirsin və ya ona bağışlasın» . Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim çətinliyə düşənə möhlət versə və ya ona bağışlasa Allah Qiyamət günü heç bir kölgənin olmadığı vaxt onu öz kölgəsində saxlayar» .

## KƏRİM - ƏKRAM

***əl-Kərim –*** Böyük, bol, şərəf mənasında işlədilmişdir. ***Rızqun Kərim*** – bol ruzi, ***Əcrun Kərim*** – böyük mükafat, ***Quranu Kərim*** – qiymətli, şərəfli Quran

---

[259] Müslim 2715.
[260] Buxari 2291.
[261] Müslim 2699.
[262] Müslim 1563.
[263] Tirmizi.

mənasındadır. ***«Çox qiymətli Qurandır».*** *(əl-Vaqiə 77).* Allahın qullarının etdikləri günahları gizlətməsi, onları ortaya çıxarmaması, qüsurlarını örtməsi Onun Kərəm sahibi olmasındandır. Mömin qullarının bəsit və kiçik itaətlərinə belə baxmayaraq böyük savablar verməsi Onun Kərəm sahibi olmasındandır. ***«Oxu, Rəbbin ən böyük Kərəm sahibidir».*** *(əl-Ələq 3).* ***«Ey insan Kərəm sahibi olan Rəbbinə qarşı səni aldadan nədir?».****(əl-İnfitar 6).* Kərim Ona üsyan edənləri, tövbələrini qəbul etməkdə ümüdsüz buraxmayan və onları sorğuya çəkmədən tövbələrini qəbul edəndir. Kərim Ondan istəyənləri boş qaytarmayan, Ona sığınanları tərk etməyən, nöqsansız və qüsursuz uca varlıqdır.

***əl-Əkram –*** Allah Əkram – olduğunu ismi tafdil (üstünlük bildirən İsim) olaraq xəbər verməkdədir. Allah Əkramul-Əkram (Kərəm sahiblərinin ən üstünüdür). Ondan başqa mütləq Kərəm sahibi yoxdur, heç kimsə Kərəm sahibi olmadan Ona bənzər olmaz deməkdir . ***«Oxu! Sənin Rəbbin ən böyük kərəm*** *(ƏKRƏM)* ***sahibidir».*** *(əl-Ələq 3).* İmam Qurtubi – *rahmətullahi aleyhi* – deyir ki: «Əkram Allahın zatıyla əlaqəli, Kərim isə Onun feliylə əlaqəli bir sifətdir. Hər iki kəlimə də ***Kə-Rə-Mə*** sözündən törənmişlər . Bu açıqlamadan başa düşülür ki, Kərim və Əkram İsimləri eyni məna ifadə etməkdədirlər. Bu məna Allahın qullarına qarşı lütfkar və ehsan sahibi olmasıdır.

Allahın Kərim olmasının bir nümunəsi də göylərdə və yerdə olan her şeyi bütün insanların xidmətinə verdiyini və onlara boyun əydirdiyini bildirmişdir. ***«Göylərdə və yerdə nə varsa hamısını öz tərəfindən sizin ixtiyarınıza qoyan da Odur».*** *(əl-Casiyə 13).* Həqiqətən də Allah Əkramul-Əkrəmindir. Kərəm sahiblərinin ən üstünüdür. Onun bənzəri bir Kərəm sahibi yoxdur.

## KƏBİR

***əl-Kəbir*** – Bu İsim fail vəznində olub böyük deməkdir. O, hər şeydən böyükdür, hər şeydən ucadır və hər şeydən uludur. Qurani Kərimdə **6** dəfə keçməkdədir . ***«Əlbəttə Allah uca*** *(ALİ)* ***və böyükdür*** *(KƏBİR)****».*** *(ən-Nisa 34).* ***«O, qeybi də, aşkarı da biləndir.*** *(hər şeydən)* ***böyük*** *(KƏBİR)* ***və ucadır*** *(MUTƏALİ)****».*** *(ər-Rəd 9).* Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «***Kəbir –*** şanı böyük və uca olandır. Ondan başqa hər böyük olan Onun böyüklüyünün altında və kiçikdir. İnsanlar arasında Kəbir yaşı daha çox olanlar üçün istifadə edilir».

## MUTƏALİ

***əl-Mutəali*** – Hər şeydən yüksəyə ucalmış mənasındadır. Allah öz zatında ucadır. Bu üzdən də hər şeydən daha ucadır. Ucalıqda Allahın heç bir qüsur və ayıbı yoxdur. O, mütləq olaraq ən ucadır. ***«O,*** *(hər şeydən)* ***böyük*** *(KƏBİR)* ***və ucadır*** *(MUTƏALİ)****».*** *(ər-Rəd 9).*

## MUMİN - MUHEYMİN

***əl-Mumin –*** Qullarına zülm etməyən, onları şərdən qoruyan, əmin edən deməkdir. ***«O, Allah ki, Ondan başqa ilah yoxdur. Məlikdir, Quddusdur, Sələmdır, Mumindir,***

---

[264] İbn Teymiyyə «Fətvaul Kubra» 16/293,296, Beyhəqi «Şərhu Əsməul Husnə» s. 264.
[265] Qurtubi «Əsna fi Şərhi Əsmailləhil Husnə» 1/131,132.
[266] Bax: Rəd 9, Həcc 62, Loğman 30, Səbə 23, Ğafir 12.

***Muhəymindir».*** *(əl-Həşr 23).* Mucahid – *rahmətullahi aleyhi* – deyir ki: «Tək və şəriksiz olduğunu doğrulayan-dır. ***«Allah özündən başqa ibadətə layiq haqq ilah olamadığına şahiddir».*** *(Ali İmran 18).* Peyğəmbəri möcüzələrlə, mömინləri vəd etdiyi savabla, inkarçıları da vəd etdiyi əzabı verməklə doğrulayandır. Dostlarını əzabından və onlara zülm etməkdən əmin edən, qullarını da qorxudan qurtarıb əminliyə qovuşduran Odur . Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «İman, təsdiq etmək, doğrulamaq deməkdir. Buna görə də mömin təsdiq edən, doğrulayan mənasındadır. Allahın mömin ismi iki mənanı verir. 1) Qullarına vəd etdiyi ruzini verməklə və yaxşı əməllərinin savabını axirətdə onlara verməklə yerinə yetirərək doğrulayandır. 2) Möminlərin Onun haqqındakı zənlərini doğru çıxarmaq. Onların ümüdlərini boşa çıxarmamaqdır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - öz Rəbbindən buyurdu: «Mən qulumun Mənim haqqımdakı zənnindəyəm. Artıq Mənim üçün dilədiyi zəndə olsun» .

***əl-Muheymin –*** Doğrulayan, təsdiq edən, hamilik edən, qoruyan deməkdir. ***«O, Allah ki, Ondan başqa ibadətə layiq haqq ilah yoxdur. Məlikdir, Quddusdur, Səlamdır, Mumindir, Muheymindir».*** *(əl-Həşr 23).* Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «***Muheymin –*** Qiyamət günü Ona ibadət edənlərin ibadətlərindən və savablarından bir şey əskiltməyəndir. O, simic deyildir ki, verdiyi savabı çox görsün və buna görə də bəzi əməlləri gizlətsin. Savab verməklə Ondan və mülkündən heç bir şey əskilməz. Allah yaxşıların yaxşılıqlarından və savablarından bir şey əskiltmədiyi kimi, asilərin də üsyanlarından və haqq etdikləri cəzalardan bir şey artırmaz. Yalan və haqsızlıq onun haqqında mümkün deyildir. ***«Biz sənə Quranı haqq olaraq, özündən əvvəlki kitabı təsdiq edən və onu qoruyan kimi endirdik».*** *(əl-Maidə 48).* İbn Abbas - *radıyallahu anhu* – deyir ki: «***Muheymin –*** doğrulayan, təsdiq edən və güvənilir mənasındadır».

# MOVLƏ

***əl-Movlə – «Allah sizin*** *(MOVLANIZ)* ***ixtiyar sahibinizdir. O, nə gözəl Mövla, necə də gözəl imdada yetəndir».*** *(əl-Həcc 78).* ***«O, ən gözəl həvadar*** *(MOVLƏ)* ***və ən yaxşı imdada çatandır».*** *(əl-Ənfal 40).* Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «***Movlə –*** yardım və dəstək gözləniləndir. Allah mülk sahibi olduğu üçün qulun Ona sığınmaqdan başqa bir çarəsi yoxdur. Çünki kölə ancaq sahibindən yardım gözləyər».

Qul Allaha dost olmalı, Ona inanmalı, Ondan gələn hər bir şeyi doğrulamalı və təsdiq etməli, əmrlərinə uymalı, qadağalarından çəkinməli, yalnız Ona güvənməli, açıq və gizli, bolluq və darlıq kimi bütün hallarda Ona təslim olmalıdır. Yalnız Onu və Rəsulunu sevməlidir.

Bəra b. Azim – *radıyallahu anhu* – rəvayət edir ki, (Uhud) döyüşündə müşriklərlə qarşı-qarşıya gəldik. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – məharətli ox atıcılarından (əlli nəfərlik) bir qrup əskəri ayıraraq başlarına da Abdullah b. Cubeyr – *radıyallahu anhu* – təyin etdi. Ona: «Bir an belə yerinizdən tərpənməyin. Hətta bizim onlara qalib gəldiyimizi görsəniz də belə yerinizdən tərpənməyin. Onların bizə qələbə çaldıqlarını (və quşların cəsədlərimizi diddiklərini) görsəniz də belə (mən sizə adam göndərmədikcə) bizə yardıma gəlməyin» deyə buyurdu. Müşriklərlə qarşılaşdığımız

[267] İbn Kəsir 8/343, Qurtubi 10/676.
[268] Əhməd 3/491.

zaman (Allah onları məğlubiyyətə uğratdı) və onlar qaçmağa başladılar. Hətta dağa doğru ətəklərini toplayaraq qaçan qadınları da gördüm. (Ayaq biləklərində olan) halqaları da belə görsənirdi. Bizimkilər belə deməyə başladılar: «Qənimət! Qənimət!» İbn Cubeyr: «Pəyğəmbər – *sallallahu aleyhi və səlləm* – sizə nə dediyini unutdunuz-mu? Yerlərinizi tərk etməyin!» deyə tənbehlədi. Oxçular onun sözünü dinləməyərək: «(Vallahi biz də qardaşlarımızın yanına gedib qənimətdən götürəcəyik)» dedilər. Onlar bu əmrə etiraz edincə üzləri tərs çevrildi. (Nə edəcəklərini bilməyən dəlisovlara döndülər) və məğlub oldular. Yetmiş şəhid verildi. Pəyğəmbər – *sallallahu aleyhi və səlləm* – təpənin üzərində İbn Cubeyr – *radıyallahu anhu* – ilə qalan (on iki) nəfəri geri çağırdı. Gecə düşdükdə Əbu Sufyan üç dəfə səsləyərək: «Aranızda Muhəmməd varmı?» deyə soruşdu. Peyğəmbər: «Ona cavab verməyin» deyə buyurdu. Əbu Sufyan təkrar üç dəfə səsləyərək: «Aranızda Əbu Kuhafə varmı?» deyə soruşdu. Peyğəmbər yenə də: «Ona cavab verməyin» deyə buyurdu. Əbu Sufyan yenə də üç dəfə səsləyərək: «Aranızda Xattabın oğlu varmı?» deyə soruşdu. Heç kimsə ona cavab vermədi. Bundan sonra Əbui Sufyan: «Onlar hamısı öldürüldülər. Əgər sağ olsalardı cavab verərdilər» dedi. Bu sözlərdən sonra dözə bilməyən Ömər: «Ey Allahın düşməni yalan söylədin. Allah Rəsulu da, Əbu Bəkr də və mən də burdayıq və sağıq» dedi. Əbu Sufyan: «Savaş bir rəqabətdir. Günə gün! (Uhud Bədrə qarşılıqdır)» dedi və: «Şanın uca olsun ey Hubel! «. Peyğəmbər: «Ona cavab verin» deyə əmr etdi. Səhabələr: «Nə deyək?» deyə soruşdular. Peyğəmbər: «Allah ən uca və ən üstündür» deyə buyurdu. Əbu Sufyan: «Bizim Uzzamız var, sizin isə Uzzanız yoxdur» dedi. Peyğəmbər: «Ona cavab verin» deyə əmr etdi. Səhabələr: «Nə deyək?» deyə soruşdular. Peyğəmbər: «Allah bizim Mövlamızdır, sizin isə Mövlanız yoxdur» deyə buyurdu. Əbu Sufyan: «Həqiqətən də siz öz ölülərinizin içindən tanınmaz hala salınmış kimsələri tapacaqsınız. Bunu mən əmr etmədim, lakin bu məni heç də məyus etmədi. Məni pisləməyin». Peyğəmbər: «Ona cavab verin» deyə əmr etdi. Səhabələr: «Nə deyək?» deyə soruşdular. Peyğəmbər: «Bizim ölülərimiz Cənnətdə, sizinkilər isə Cəhənnəmdədir» deyin .

## MƏLİK – MƏLĪK – MƏƏLİK

***əl-Məlik – əl-Məlīk*** **-** Hökmüdar, kral mənasında bir kəlimədir. ***Mə-Lə-Kə*** felindən gəlir. Məlik, sahib olmaqdır. Həm bir şeyə sahib olmağı, həm də qüvvətli olmağı əhatə edir. ***O, özündən başqa heç bir ilah olmayan Məlikdir*** *(mütləq sahibdir)***».** *(əl-Həşr 23).* ***Məlik*** – kəliməsi də işlədilə bilər. Mütləq Məlik ancaq və ancaq Allahdır. Çünki Quranda mülkün yalnız Allaha aid olması dəfələrlə qeyd edilmişdir. ***«Göylərin və yerin, ikisi arasında olanların mülkü Allahındır».*** *(əl-Maidə 18).* ***«De ki: «Allahım! Mülkün sahibi. Mülkü dilədiyinə verir, dilədiyindən isə alırsan».*** *(Ali İmran 26).* ***«Haqq Məlik olan Allah ucadır».*** *(əl-Muminun 116).* ***«Haqq məclisində, qadir hökmüdar*** *(MƏLĪK)* ***Allahın hüzurunda olacaqlar».*** *(əl-Qəmər 55).* Allah həqiqi Rəbb, həqiqi Məlik və həqiqi İlahdır. O, Rəbb olması ilə bütün varlıqları yaratmış, Məlik olması ilə hamısına üstün gəlmiş, İlah olması ilə də onlara ibadət etmələrini əmr etmişdir. Bu üç sözün dərin mənalarını, ucalıq və ululuğunu yaxşıca düşün. Allah bu üç sözü ən gözəl bir ifadə və üslub ilə Nəs surəsində birlikdə zikr edərək: «İnsanların

---

[269] Bəni Kinanə qəbiləsinin ibadət etdikləri bütün adıdır. Kəbədə yerləşirdi.
[270] Buxari 3039, Təfsir Ali İmran 10, Məğazi 9,17,20, Əbu Davud 2662.

Rəbbi, İnsanların Məliki, İnsanların İlahı. Bu üç tamamlama imanın bütün təməllərini və Allahın gözəl İsim və Sifətlərinin mənalarını əhatə etməkdədir. Allah bizim tək Rəbbimiz, Məlikimiz, və İlahımız olduğuna görə sıxıntı və müsibət anlarında Ona sığınmaqdan başqa çarəmiz yoxdur. Bizim Ondan başqa bir sığınacağımız, barınacağımız məbudumuz yoxdur. Buna görə də sadəcə Ona dua edilməli, yalnız Ondan qorxulmalı və Ona ümüd bağlanmalıdır. Ondan başqa kimsə sevilməməli, boyun əyilməməli və itaət edilməməlidir. Yalnız Ona güvənməliyik. Ondan başqa Rəbb yoxdur. O, bütün varlılıqların məlikidir. Sən də daxil bütün varlılıqlar Onun mülküdür. Rəbbin və Məlikin olan. Həm də sənin İlahındır. Bir an belə Ona ibadət etməkdən uzaq durma. Sənin Ona olan ehtiyacın həyata və ruha olan ehtiyacından daha çoxdur. Bütün bunları bilən Rəbbə, Məlikə və İlaha sahib olduğunu bilən Ondan başqa kimsədən yardım diləməz, başqasına sığınmaz, başqasına dua etməz, qurban kəsməz, nəzir deməz.

***əl-Məəlik – “Haqq-Hesab** (Qiyamət) **gününün sahibinə!”.** (əl-Fatihə 4).*

# MUTƏKƏBBİR

***əl-Mutəkəbbir - «O, özündən başqa heç bir ilah olmayan, gizlini də, aşkarı da bilən Allahdır. Mutəkəbbirdir** (təkəbbürlük haqqına tək sahib olandır)». (əl-Həşr 22-24).* Allah mütəkəbbirdir. Ucalıq və əzəmətdə ona qarşı çıxan azğın varlıqların bellərini qırıb güclərini yox edəndir. Mütəkəbbirdə olan ***Ta*** hərfi təklik bildirməkdə və təkəbbürlüyün yalnız Allaha məxsus olduğunu bildirməkdədir. Təkəbbürlük varlıqların həqiqi sifəti deyildir. Çünki varlıqların özəlliyi itaət etmək və boyun əyməkdir. Həqiqi təkəbbürlük Allaha məxsusdur. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Böyüklük (***Kibriya***) mənim ridam (örtüyümdür), ucalıq isə izarımdır. Kim bu ikisindən biri üzərində mənimlə çəkişərsə onu yox edərəm (Cəhənnəmə ataram)» . Qatadə – *rahmətullahi aleyhi* – deyir ki: «Pislikdən imtina edərək böyüklənəndir». Əbu İshaq – *rahmətullahi aleyhi* – deyir ki: «Qullarına zülm etməkdən uzaq və ucadır». Qazali – *rahmətullahi aleyhi* – deyir ki: «***Mütəkəbbir*** özündən başqa hər şeyi kiçik görən, böyüklük, üstünlük və ucalığı yalnız özündə görən, başqasına, padşahların qullara baxdığı kimi baxandır. Əgər bu baxış gərçək və doğru isə həqiqi təkəbbürlük budur. Belə baxan həqiqi təkəbbürlüyü haqq etmişdir. Bu durum Allahdan başqa heç bir varlıq üçün düşünülməz. Bu yalnız Onun haqqıdır». Qurtubi – *rahmətullahi aleyhi* – deyir ki: «***Mütəkkəbir*** – Rəbb olması ilə hər bir varlılıqdan üstün və böyük olandır. Onun bənzəri, şəriki yoxdur. Hər cür pislikdən uzaqdır. Bütün çirkin sifətlərdən münəzzəhdir. Mütəkəbbir sözünün əsli imtina etmək və boyun əyməkdir. Buna görə də Allah bütün pis sifətlərdən imtina edər və heç bir varlığa boyun əyməz. Mütləq uca və böyük olan yalnız Odur».

# MƏCİD

***əl-Məcid – «Allahın rəhməti və bərəkəti sizin üzərinizə ey ev əhli şübhəsiz ki, O, tərifə layiq olandır, Məciddir».** (Hud 73). **«Ərşin sahibidir, Məciddir».** (əl-Buruc 15).* Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: «***Məcid*** – ucalıq, ululuq, şanlı, şərəf, kərəm və ehsanı bol olandır. ***Məcd*** – bolluq və genişlik mənasındadır». Qurani Kərimdə Həmd

---

[271] Buxari, Müslim.

və Məcid İsimləri bir yerdə **2** ayədə zikr olunmuşlar. ***«O, həmd*** *(övülməyə layiq)* ***olandır, Məciddir».*** *(Hud 73).*

## MUHİT

***əl-Muhit – «Bil ki, Allah hər şeyi ehtiva*** *(əhatə MUHİT)* ***edəndir».*** *(Fussilət 54).* Həlimi – *rahmətullahi aleyhi* – deyir ki: «***Muhit*** **–** Ondan qaçmaq mümkün olmayandır. Elmi, gücü qüdrəti bütün varlılıqları əhatə edəndir. ***«Onun hər şeyi elmi ilə əhatə etdiyini».*** *(ət-Taləq 2).* Allah elmi ilə hər bir şeyi bilir. O, elmi ilə bütün bilikləri, görməsi ilə bütün görünənləri, eşitməsi ilə də bütün eşidilənləri əhatə edir. Hər şey Ona boyun əymişdir.

## MUHSİN

***əl-Muhsin*** – Yaxşılıq edən, xeyirxah işlər görən, minnət etmədən verən deməkdir. ***Əhsanə*** felindən ismi fail olaraq alınmışdır. Qurani Kərimdə İsim olaraq deyil fel olaraq keçər. ***«O, mənə yaxşılıq etdi, çünki məni zindandan qurtardı».*** *(Yuxuf 100).* Əbu Yəla Şəddad b. Əus - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həqiqətən də Allah hər şeydə ehsanı yazmışdır. Öldürdüyünüz zaman gözəl şəkildə öldürün. Kəsdiyiniz zaman gözəl bir şəkildə kəsin. Sizdən (heyvan kəsən şəxs) bıçağını yaxşıca itiləsin və kəsəcəyi heyvanı rahatlasın» .

***Allahın İnsanlara Olan Ehsanı:*** Onları yoxdan var etməsi və onlara digər varlıqlardan daha gözəl bir biçimdə yaratması. ***«Sizə surət verən və surətlərinizi gözəlləşdirən …Allahdır».*** *(əl-Mumin 64).* Digər canlılardan fərqli olması, düşünə bilməsi və hidayət yolunu görə bilməsi üçün ona ağıl verdi. ***«Biz ona hidayət yolunu göstərdik. O, ya şükr edər, ya da nankorluq».*** *(İnsan 3).* ***«Sizə şükr edəsiniz deyə qulaq, göz və qəlb verdik».*** *(ən-Nəhl 78).* İslama hidayət etməsi. Allahın quluna ən böyük ehsanı budur. Vəhb b. Münəbbi – *rahmətullahi aleyhi* – deyir ki: Nemətlərin başı üçdür. İlki İslam nemətidir. Bütün nemətlər yalnız bununla tamam olur. İkinci nemət sağlamlıq nemətidir. Üçüncü nemətdə zənginlik nemətidir ki, bu nemət olmadan həyatın dadı olmaz». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnsanlardan bir çoxunun qəflətdə olduqları iki nemət vardır (onların qədrini heç vaxt bilməzlər). Sağlamlıqlarının və vaxtın» . Onu Nəbiləri Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in ümmətindən etməsi. Bu ümmətin digər ümmətlərdən üstün olduğuna görə. ***«Siz insanlar üçün çıxarılmış ən xeyirli ümmətsiniz».*** *(Ali İmran 110).* Onlara kitabı olan Qurani Kərimi nazil etməsi və öyrətməsi. ***«Həqiqətəndə bu bir öyüd-nəsihətdir. Kim istəsə Rəbbinə tərəf yol tutar».*** *(Dəhr 29).* ***«Bu nazil etdiyimiz mübarək bir kitabdır. Ona tabe olun ki, bəlkə sizə rəhm olunsun».*** *(əl-Ənam 155).*

## MUSAVVİR

***əl-Musavvir –*** Surət verən deməkdir. ***«O, yaradan, yoxdan var edən və*** *(hər şeyə)* ***surət verəndir*** *(MUSAVVİR)****».*** *(əl-Həşr 24).* Həlimi – *rahmətullahi aleyhi* – deyir ki:

---

[272] əl-Albani «Səhih Hədislər Silsiləsi» 469.
[273] Müslim 1955, AbdurRazzaq "Musənnəf" 4/392, əl-Albani "Səhih Cəmi" 1/129, "İrva" 7/293.
[274] Buxari 6412.

«***Musavvir*** – istədiyinə istədiyi şəkili və biçimi verəndir». ***«Yaradanların ən gözəli olan Allah ən ucadır».*** *(əl-Muminun 14).* ***«Sənə istədiyi surəti verdi».*** *(əl-İnfitar 8).* Allah insanı anasının bətnində ikən onu üç mərhələdən keçirərək surət verir. Birinci mərhələdə bir qan laxtası şəkilində olur, ikinci mərhələdə bir ət parçası şəkilində, üçüncü mərhələdə isə bir şəkil və biçim olaraq yaradılır. Əbu Abdurrahmən Abdulla b. Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, doğru sözlü və doğru sözü təsdiq olunan Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Sizdən hər birinizin yaradılışı onun anasının qarnında qırx gün nütfə şəklində olaraq bir yerə gətrilir. Sonra bu müddət ərzində aləqa şəklində olur. Sonra yenə bu müddət ərzində mudğa şəklində olur. Sonra ona bir mələk göndərilir, hansı ki, ona ruh üflədikdən sonra dörd xüsusiyəti yazmaqla əmr olunur. Ruzisini, əcəlini, əməlini, bədbəxt və ya xoşbəxt olacağını (Başqa rəvayətdə: «Qulaqlarını, gözlərini, dərisini, ətini və sümüklərini taradır)» . Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Allah surət yaradanlara lənət edib» . Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Qiyamət günü insanlar arasında əzabı ən şiddətli olanlar Allahın yaratdıqlarına bənzə bir şeylər yaratmaq istəyənlərə olacaqdır» . Rəsulullah – *sallallahu aleyhi və səlləm* – öz Rəbbindən buyurdu: «Mənim yaratdıqlarıma bənzər şeylər yaradanlardan daha zalim kim ola bilər? Belə edənlər bacarırlarsa bir zərrə və ya bir dənə yaratsınlar!» . İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Surət çəkənlər oddadırlar. O, surətlərə ruh veriləcək ki, onlar da (surət çəkənləri) cəzalandıracaqlar. Əgər sən bunu etmək istəyirsənsə onda canlı olmayan (təbiət və s) şəkillər çək» .

## MUHSƏN

***əl-Muhsən*** **–** İbn Həzm bunu zikr edir.

## MUQADDİM – MUƏXXİR

***əl-Muqaddim – əl-Muəxxir*** **–** Hər iki İsim Qurani Kərimdə zikr edilmir. Hətta Muqaddim ismi fel olaraq da keçmir. Ancaq Muəxxir ismi Quranda fel olaraq keçir. ***«Allah onların cəzasını yubadıb elə bir günə saxlayır ki, həmən gün gözləri hədəqəsindən çıxar».*** *(İbrahim 42).* Hədislərdə isə İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – gecə namazlarında İstfitah dualarında buyurardı: «Ya Allahım!… ***Mə Qaddəmtu Və Mə Əxxartu Və Əsrartu Və Ələntu*** – əvvəldən etdiyim və sonradan etdiyim günahlarımı Allahım sən məğfirət et!» . Bu İsimlərdən yalnız biri ilə dua etmək caiz deyildir. İkisi də Allahın feli sifətlərindəndir. Dilədiyini yüksəldən, dilədiyini də alçaldan, dilədiyini əziz edən, dilədiyini də zəlil, dilədiyini Özünə yaxınlaşdıran, dilədiyini də uzaqlaşdıran O, olduğu

---

[275] ***Nütfə*** – məni mənasındadır. Nütfə bəzən də saf su adlanır.
[276] ***Aləqa*** – laxtalanmış qan, ziyil deməkdir. ***«O, insanı laxtalanmış qandan yaratdı».*** *(əl-Ələq 2).*
[277] ***Mudğa*** – çeynənilmiş ət parçasına oxşadığı üçün ona bu ad verilmişdir.
[278] Buxari, Müslim.
[279] Buxari 10/293.
[280] Müslim 2107.
[281] Buxari 2953, Müslim 2111.
[282] Buxari, Müslim.
[283] Buxari 1120, Müslim 769.

kimi irәli aparan (әvvәlә keçirәn) vә arxaya atan (tәxirә salan) da Odur. İrәlidә olan kimsә әn yüksәk mәrtәbәlәrә çıxar, geridә qalan isә әn aşağı mәrtәbәlәrә enәr. Hәlimi – *rahmәtullahi aleyhi* – deyir ki: «***Muqaddim*** **–** yüksәk mәrtәbәlәrә çıxardan. ***Muәxxir*** **–** yüksәk mәrtәbәlәrdәn endirәndir. Allah nәbilәri, möminlәri Özünә yaxınlaşdırmış, düşmәnlәrini dә Özündәn uzaqlaşdıraraq alçaq mәrtәbәlәrә endirәn vә Özü ilә onlar arasına pәrdә çәkәndir». İbn Qeyyim – *rahmәtullahi aleyhi* – deyir ki: «Bu isimlәr Allahın hәm feli, hәm dә zatı sifәtlәrindәndir…» . İnsanları bir-birindәn üstün edәn Odur. Allah dilәdiyi kimsәlәri irәli çәkәr, dilәdiklәrini dә geri atmışdır. Hәr şey Onun iradәsi vә hikmәti ilә hәyata keçir. Geri atdığını önә çәkmәz, önә çәkdiyini dә geri atmaz. Bu İsimlәri bir yerdә zikr etmәk tәk-tәk zikr etmәkdәn yaxşıdır. Rәsulullah – *sallallahu aleyhi vә sәllәm* – әn yüksәk mәrtәbәlәrә: ***«Sәnin şanını ucaltmadıqmı».*** *(әl-İnşiraq 4).* Buna qarşılıq da Әbu Lәhәbi әn aşağı mәrtәbәyә endirmişdi. Allahın bu isimlәrini bilәn kimsә ibadәt vә yaxşılıqların çoxluğuna arxayın olmaz, günah vә pisliklәrin çoxluğu ilә dә Allahdan ümüd kәsmәz. Çünki Allaha uzaq görünәn kimi neçә kimsәlәr vardır ki, yaxın, yaxın görsәnәn kimi dә neçә kimsәlәr vardır ki, Ondan uzaqdırlar.

## MUQİT

***әl-Muqit – «Allah hәr şeyә azuqәsini*** *(ruzisini MUQİT)* ***verәndir».*** *(әn-Nisa 85).* ***«Rәbbiniz göylәri vә yeri altı gündә xәlq edәn, sonra әrşi yaradıb isteva edәn, hәr işi yoluna qoyan Allahdır».*** *(Yunus 3).* ***Muqit*** **–** hәr insana vә heyvana zamanına görә azuqәsini verәn demәkdir. Allah bütün canlıların ruzi vә azuqәlәrini varlılıqlarını davam etdirәcәk şәkildә verәndir, sonda isә onlar üçün müәyyәn bir müddәt bitdikdә azuqәlәrini kәsәrәk varlılıqlarına son verәndir. Digәr mәnası: ***Muqit*** **–** bir şeyi qoruyan, güclü vә qüvvәtli, ruzi verәn – demәkdir. İbn Abbas - *radıyallahu anhu* – deyir ki: «***Muqit*** - Muqtәdir güc vә qüvvәt sahibi, әmәllәrin qaşılığını verәn deyә açıqlamışdır». Mucahid - *radıyallahu anhu* – deyir ki: «Şahid, görәn, hesablayan» demәkdir. Qatadә vә İbn Kәsir – *rahmәtullahi aleyhi* – deyirlәr ki: «Qoruyan» demәkdir .

## MUBİN

***әl-Mubin*** **–** Açıq-aydın, açıq-aşkar demәkdir. ***«O, gün Allah onların cәzasını layiqincә verәcәk vә onlar Allahın açıq-aşkar*** *(MUBİN)* ***bir haqq olduğunu bilәcәklәr».*** *(әn-Nur 25).*

## MӘNNӘN

***әl-Mәnnәn*** **–** Mәrhәmәti vә lütfkarlığı geniş olan demәkdir. Bu İsim quranda fel olaraq keçir. ***«…Bilin ki, sizi imana müvәffәq etmәklә әslindә Allah sizin boynunuza minnәt qoymuşdur».*** *(әl-Hucurat 17).* ***«Allah möminlәrә qarşı lütf göstәrdi».*** *(Ali İmran 164).* Әnәs b. Mәlik - *radıyallahu anhu* – rәvayәt edir ki, Peyğәmbәr – *sallallahu aleyhi vә sәllәm* – bir nәfәrin belә dediyini eşitdikdә: "***Allahummә İnniy Әs'әlukә Bi Әnnә Lәkәl-Hәmd, Lә İlahә İllә Әntә Vәhdәkә Lә Şәriykә Lәkә, Әl-Mәnnanu, Yә Bәdi'as-Sәmәvati Val-Ard, Yә Zәl-Cәlәli Val-İkram, Yә Hәyyu, Yә***

[284] әs-Sәdi «Tavdihul Kәfiyәtuş Şafiyә» s. 131,132.
[285] Qurtubi 1/273, İbn Kәsir 2/144, Beyhәqi s. 47.

***Qayyum, İnniy Əs'əlukəl-Cənnətə Və Əuzu Bikə Minən-Nər*** - Allahım, Sənə yalvarıram! Həmd Sənədir. Səndən başqa məbud yoxdur, Təksən, heç bir şərikin yoxdur. Lütfkarsan! Ey göyləri və yeri Yaradan! Ey əzəmət və ehtiram sahibi! Ey Yaşayan, ey Qəyyum! Səndən Cənnəti diləyirəm və Cəhənnəmdən Sənə sığınıram!" buyurdu: Artıq Allahadan Onun əzəmətli İsmi ilə istənildi. Hansıki əgər onunla istənilərsə əta olunar, dua edilərsə cavab verilər"[286]. Minnət qoymadan lütfkar və mərhəmətli olan.

***Minnət İki Cürdür: Bəyənilən*** - Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnsanlar arasında malı ilə mənə ən çox minnət edən (yaxşılıq edən) Əbu Bəkrdir (Başqa rəvayətdə: Mənə Əbu Kuhafənin oğlundan daha çox minnət edən yoxdur)». ***«Allah qullarından dilədiyinə lütf edər».*** *(İbrahim 11).* Bu hədis və ayələrdə keçən minnət sözü lütf etmək deməkdir. ***Bəyənilməyən*** - İnsanın etdiyi bir yaxşılığı təkrarlaması, xatırlaması və başa qaxmasıdır. Bu minnət də, sahibləri də pislənmişdir. ***«Ey iman gətirənlər! Sədəqələrinizi malını riyakarlıqla sərf edən, Allaha və axirət gününə inanmayan şəxs kimi, minnət qoymaq və əziyyət verməklə puça çıxarmayın».*** *(əl-Bəqərə 264).* Əbu Zərr - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Üç kimsə vardır ki, Qiyamət günü Allah onlarla danışmaz, onlara nəzər salmaz (baxmaz), onları təmizə çıxarmaz və onlar üçün şiddətli bir əzab vardır. Bunalr Paltarının ətəklərini yerlə süründürən (Başqa rəvayətdə: «İzarın ayaq biləngindən aşağı olan qismi atəşdədir», «Möminin paltarı baldırının yarısına qədərdir. Bundan ayaq bilnginə qədər olsa da bunda bir eyb yoxdur. Lakin bundan daha aşağı olan hissə atəşdədir»), verdiyi şeyi başa qaxan və yalan andlarla malını satan kimsə» . Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Üç kimsə vardır ki, Qiyamət günü Allah onlarla danışmaz, onlara nəzər salmaz (baxmaz), onları təmizə çıxarmaz və onlar üçün şiddətli bir əzab vardır. Bunalr zinakar yaşlı, yalançı dövlət başçısı və təkəbbürlü kasıb» . Əbu Hurəyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Üç kimsə vardır ki, Qiyamət günü Allah onlarla danışmaz, onlara nəzər salmaz (baxmaz), onları təmizə çıxarmaz və onlar üçün şiddətli bir əzab vardır. Bunalar susuz bir səhrada suyu olduğu halda səfər yoldaşından onu gizlədən, Əsr namazından sonra mal satar və bu malı satarkən filan-filan qiymətədir deyərək müştərini aldadaraq Allaha and verər. Müşdəri də onu təsdiq edib malı alan kimsə, bir dövlət başçısına yalnız dünya malı üçün beyət edər. Əmr ona dünyalıq mal verdiyi zaman əhdinə sadiq olar, ona dünyalıq verilmədiyi zaman əhdinə sadiq olmaz» . ***«Etdiyin əməli çox bilib başa qalxma».*** *(əl-Muddəsir 6).* İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: «Etdiyin əməlləri çox görüb Rəbbinə minnət etmə» . Bu İsimləri bilən müsəlman Allahın ona verdiyi nemətlərlə hər hansı bir kimsəyə yaxşılıq etdikdə bu yaxşılığı əsla başa qaxmamalıdır. Öz yaxşılığını kiçik görüb onu unutmalıdır. Üstünlüyü özündə deyil yaxşılığı qəbul edəndə görməlidir. Buna görə qul həqiqi lütf sahibinin O, olduğunu bilməli və bunu etiraf etməlidir. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – Ənsar topluluğuna buyurdu: «Sizlər dağınıq ikən Allah

---

[286] Əbu Davud 2/80,1495, İbn Məcə 2/1268, Nəsəi 3/52, Tirmizi 5/550, Səhih Nəsəi 1/279, H. 1233, Səhih İbn Məcə 2/329, H. 3112.
[287] Buxari, Müslim 106, Əbu Davud.
[288] Müslim 107.
[289] Müslim 108.
[290] İbn Kəsir 8/442.

mənimlə sizi bir yerə toplamadımı? Sizlər fəqir ikən Allah mənimlə sizi zəngin etmədimi? Sizlər ölkənizdə qorxu içində ikən Allah mənimlə sizi hüzur və əmin-amanlığa qovuşdurmadımı?». Ənsar da Allahın üzərilərindəki lütf və ehsanını etiraf edərdilər .

## MUSTƏAN

***əl-Mustəan* – “***(Peyğəmbər)* ***dedi: “Ey Rəbbim!*** *(Mənimlə məni təkzib edən Məkkə müşrikləri arasında)* ***ədalətlə hökm et. Sizin mənə aid etdiyiniz sifətlərə*** *(dediyiniz pis sözlərə)* ***qarşı kömək dilənilməsi kimsə yalnız Rəhman olan Rəbbimizdir!”.*** *(əl-Ənbiya 112)*[292].

## MUSƏ’İRU

***əl-Musə’iru*** - Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in dövründə qiymətlər artmağa başladı. İnsanlar: “Ey Allahın Rəsulu! Qiymətlər artdı. Bizə bir qiymət təyin et (Qiymətlərə hədd qoy)” dedilər. Peyğəmbər: “Qiymətləri tənzimliyən Allahdır, Genişlədib çox-çox verən Allahdır, Ruzi verən Allahdır, Daraldıb qıtlıq gətirən də Allahdır. Mən Allaha yanımda kimsənin mal və qan haqqı olamadığı halda çatmağı ümüd edirəm” deyə buyurdu .

## VƏDUD

***əl-Vədud*** – Sevən və sevilən mənasına gələn Vədud İsmi Qurani Kərimdə **2** dəfə keçməkdədir. İki mənası vardır: 1) Fail vəznində gələn ***Sevən*** mənasında. Uca Allah Peyğəmbərləri, nəbiləri, dostlarını və inanan qullarını sevər. 2) Məful – vəznində isə ***Məvdud*** - sevilən mənasındadır. Yəni Allah sevilməyi haqq edəndir. O, qulun sevdiklərindən daha üstün bir sevgini haqq edəndir. Hətta O, qulun öz gözündən, qulağından və nəfsindən daha sevimlidir . ***«Şübhəsiz ki, Rəbbim Rəhim*** *(çox mərhəmətli)* ***və Vədud*** *(qullarını çox sevəndir)****».*** *(Hud 90).* ***«O, çox bağışlayan və çox sevəndir».*** *(əl-Buruc 14).* Vədud (sevmə) İsmi, Rahim (mərhəmət etmə) İsmi ilə Ğafur (bağışlama) İsminə daha yaxın bir məna ifadə edər. Lakin aralarında fərq vardır. İnsan ona qarşı pislik edəni bağışlaya bilər, lakin onu sevməyə bilir. Yenə də sevmədiyi bir kimsəyə mərhəmət etməyə də bilir. Allah isə tövbə edən qulunu bağışlar, ona mərhəmət edər və heç nəyə baxmayaraq onu sevər. Çünki O, tövbə edənləri sevər. ***«Allah tövbə edənləri də sevər».*** *(əl-Bəqərə 222).* Varlılıqları düşündüyün zaman uca Allahın sevən və sevilən olduğunu görürsən. Allah peyğəmbərləri, mələkləri və mömin qullarını sevər, onlar da Onu sevərlər. Hətta onlar üçün Allahdan daha sevimli başqa bir şey yoxdur. Allah sevgisi heç bir tərəfdən başqa sevgililərə bənzəməz. Bu sevgi başqa sevgililərdə olmaz. O, halda Allah sevgisi hər qulun qəlbində mütləq olması və hər sevgidən əvvəl gəlməsi lazımdır. Onun sevgisi hər sevgidən üstün gəlməlidir. Sevilənin hər istəyi yerinə yetirilməli və Ona bağlı qalınmalıdır. Allah sevigisi əməllərin özü və ruhudur. Açıq və gizli bütün ibadətlər Allah sevgisindən

---

[291] Buxari 4330, Müslim 1061.
[292] Tirmizi 3021.
[293] Əbu Davud 3451, Tirmizi 1314, əl-Albani “Səhih Sünən Tirmizi” 2/32, “Səhih Sünən İbn Məcə” 2/15.
[294] İbn Qeyyim «Cəlaul Əfham» s. 28.

qaynaqlanırlar. Qulun Rəbbini sevməsi Allahın ona bir ehsanıdır. Qulun bu sevgidə bir gücü, qüdrəti və müdaxiləsi yoxdur. Qulun özünü sevməsini və sevgini qulun qəlbində yerləşdirən Allahdır.

Sevgini yaradan və onu möminlərin qəlbinə yerləşdirən uca Allah çox mübarəkdir. Daha sonra O, bu sevgini dostlarının qəlbində elə bir nöqtəyə çatdırır ki, artıq bu nöqtədə digər sevgililər çox kiçik və dəyərsiz hala gəlir, bəla və müsibətlər onlara xəfif gəlir, ibadət və itaətlərin zorluqları onlara zövq verir və sonunda sevgilərin ən ucası olan Allah sevgisini, Allah rizasını əldə etmə və Allaha yaxın olma kimi kəramətlərdən dilədiyini əldə edir .

## VAHİD – VİTR

***əl-Vahid*** – Tək var olan, yanında bir başqası olmayan, ortağı və şəriki olmayan, zatında, sifətlərində, isimlərində, fellərində ortağı və bənzəri olmayan, misli və bənzəri olmayan deməkdir. Bu isim Qurani Kərimdə **21** yerdə keçməkdədir. ***«Sizin tanrınız tək olan*** *(VAHİD)* ***Allahdır».*** *(əl-Bəqərə 163).* Bu məqam Allahdan başqa ilah olmadığına şahidlik etmə məqamıdır. Çünki Allahdan başqa ilah olması, batil və belə bir şey mümkün deyildir. Ondan başqa ilah yoxdur. Ondan başqa heç kəs ibadət edilməyə və səcdə edilməyə layiq deyildir. *«(Ya Peyğəmbər!)* ***De ki: «Əgər Rəhmanın bir övladı olsa,*** *(ona)* **ibadət edənlərin birincisi mən olaram».** *(əz-Zuxruf 81).* ***«Halbuki Allaha özünə övlad götürmək yaraşmaz. Çünki göylərdə və yerdə olan bütün məxluqlardan bir eləsi yoxdur ki,*** *(Qiyamət günü)* ***Rəhmanın hüzuruna bir qul kimi gəlməsin».*** *(Məryəm 92).* Ondan başqa birisinin ilah olması o, kimsəyə əzabdır. Ondan başqa bir kimsənin heç bir şeyə möhtac olmaması sapıqlıqdır, Ondan başqa bir kimsənin izzət sahibi olması zillət və alçağlıqdır. Ondan başqa bir kimsənin hər şeyi çoxaldıb, artırması dəyərsiz və önəmsizdir. Yaradılmış bir varlığın Ondan başqa Rəbbi olması və İlahı olması mümkün deyildir. Onunla birlikdə başqa bir ilahın olması mümkün deyildir. Çünki həqiqətdə ilah heç bir şeyə möhtac deyildir, hər şey Ona möhtacdır, heç bir kimsəyə möhtac deyildir, hər şey Onunla var olmuşdur və varlığı başqa bir şeyə bağlı deyildir. Kainatda iki ilahın da olması imkansızdır. Əgər kainatda iki ilah olsa kainatın müvazinəti çox böyük bir fəsadla pozular və böyük bir pozğunluqla bir-birinə qarışar. ***«Əgər yerdə və göydə Allahdan başqa tanrılar olsaydı onların ikisi də*** *(müvazinətdən çıxıb)* ***pozulardı. Ərşin sahibi olan Allah müşriklərin aid etdikləri sifətlərdən təmamilə uzaqdır».*** *(əl-Ənbiya 22).* ***«Allah özünə heç bir övlad götürməmişdir. Onunla yanaşı heç bir tanrı yoxdur. Əgər belə olsaydı onda hər bir tanrı əlahiddə öz yaratdıqları ilə gedər və onların bir qismi*** *(dünyadakı padşahlar kimi)* ***digərinə üstün olmağa çalışardı. Allah müşriklərin*** *(Ona)* ***aid etdikləri sifətlərdən tamamilə kənardır».*** *(əl-Muminun 91).* Bil ki, qulun bir olan Allaha ibadət etməsi, sevgi xüsusunda Ona heç bir şeyi ortaq qoşmaması, Ondan qorxma, Ona ümüd bağlama, Ona təvəkkül etmə, Onun üçün saleh əməl etmə, Onun adına and içmək, Onun üçün nəzir etmək, Onua boyun əymə, Ona xuşu duyma, təzim etmək, səcdəyə qapanmaq, Allaha ehtiyac duymaq, bədənin ruha və gözün işığa ehtiyac duymasından daha böyükdür. Bu ehtiyac duymağa müqayisə edilə biləcək bənzər bir şey daha yoxdur. Çünkü qul ruh və qəlbdən meydana gəlməkdədir.

---

[295] Şərhu Qasidətun Nuniyyə s. 96.

Qulun ilahı hər halda və hər vaxta ona gərəkli olandır. O, həqiqi ilah olub Ondan başqa qalan bütün ilahlar batildir. Qul harada olursa olsun Allah sıxıntı anında və ehtiyac duyduqda onunla birlikdədir. Yox olub gedən ilahlar heç bir zaman işə yaramaz. Buna görə də İbrahim – *əleyhissəlam* – buyurmuşdur: ***«Gecə qaranlığı İbrahimi bürüdükdə o, bir ulduz görüb: «Bu mənim Rəbbimdir» dedi. Ulduz batdıqda isə: «Mən batanları sevmirəm» dedi. Doğan ayı görüb: «Bu mənim Rəbbimdir» dedi. Ay batdıqda isə: «Doğuran da əgər Rəbbim məni doğru yola yönəltməsydi mən zəlalətə düşənlərdən olardım» dedi. Doğan günəşi görüb: «Bu mənim Rəbbimdir. Bu daha böyükdür» dedi. Günəş batdıqda isə: «Ey camaatım! Mən həqiqətən də sizin Allaha şərik qoşduqlarınızdan uzağam».****(əl-Ənam76,78).*

***əl-Vitr*** – ***«Sizin ilahınız tək bir İlahdır. Ondan başqa heç bir İlah yoxdur».*** *(əl-Bəqərə 163).* Əli – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Həqiqətən Allahın oxşarı yoxdur və O, təkdir. Allahı tək olanı sevir. Ey Quran oxuyanlar! Vitr namazını qılın» . Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurur: "Allahın doxsan doqquz – yüzdən bir əskik adı vardır. Kim bu isimləri sayarsa Cənnətə girər. Allah təkdir və tək olanı da sevir" .

## VƏLİ

***əl-Vəli*** – İşəlri düzəldən, idarə edən, dost, köməkçi deməkdir. Buna görə də şəhərin böyüyünə Vəli deyilir. ***«O, Vəlidir, Həmiddir».*** *(əş-Şura 28).* Həmçinin yardım edən. Dəstək verən mənasındadır. ***«Allah iman edənlərin Vəlisi*** *(dostu və dəstəkçisidir).* ***Onları zülmətdən nura çıxarar…».*** *(əl-Bəqərə 257).* ***«Allah iman edənlərin Vəlisidir. Kafirlərin isə vəlisi yoxdur».*** *(Muhəmməd 11).* Bu ismi bilən hər bir müsəlman inkarçılarla olan dostluğu kəsməlidir. ***«Möminlər möminləri buraxıb kafirləri özlərinə dos etməsinlər. Onlardan sizə bir qorxu olmayınca bunu edən kəs Allahdan heç bir şey gözləməsin».*** *(Ali İmran 28).* Onları dost və yaxın etməməlidir. ***«Ey iman gətirənlər! Özünüzdən başqasını özünüzə sirdaş*** (dost) ***tutmayın. Onlar sizin barənizdə fitnə-fəsad törətməkdən əl çəkməzlər. Sizin zərərə və əziyyətə düşməyinizi istərlər. Həqiqətən onların sizə qarşı olan ədavəti ağızlarından çıxan sözlərdən aşkar olur. Amma ürəklərində gizlətdikləri isə daha böyükdür. Əgər düşünüb dərk edirsinizsə ayələri artıq sizə izah etdik».*** *(Ali İmran 118).* ***«Siz elə kimsələrsiniz ki, onları sevirsiniz. Onlar isə sizləri sevməzlər. Siz kitabın hamısına inanırsınız, onlar isə sizinlə görüşdükləri zaman biz də inandıq deyirlər. Xəlvətdə olduqları zaman isə sizə qarşı qəzəblərindən barmaqlarını gəmirərlər. De ki: «Acığınızdan ölün». Əlbəttə Allah ürəklərdə olanları biləndir».*** *(Ali İmran 119).* ***«İndi siz Məni qoyub onu və övladını özünüzə dostmu tutursunuz?».*** *(əl-Kəhf 50).*

## VƏKİL

***əl-Vəkil*** – Etibar edilən, vəkil, himayə edən mənasındadır. ***«Vəkil olaraq Allah yetər».*** *(ən-Nisa 81).* ***«Allah bizə yetər. O, nə gözəl Vəkildir».*** *(Ali İmran 173).* ***«Məndən başqa heç bir Vəkil tutmayın».*** *(əl-İsra 2).* İnsanın vəkil təyin etməsi öz işini başqasına etibar etməsi, başqasını vəkil təyin etməsidir. Filankəsi vəkil təyin etdim –

---

[296] Buxari 6410.
[297] Əbu Davud, Tirmizi.
[298] Buxari "Kitabu Dəuvə", "Fəthul Bəri" 11/214, H. 6410, Müslim 4/2062, H. 3507.

dedikdǝ onu öz yerimǝ qoydum demǝkdir. Vǝkil bütün varlılıqların ehtiyac duyuduqları bütün işlǝrini tǝk vǝkil olan Allaha hǝvalǝ etmǝkdir. Allaha güvǝnib dayanmaq, Ona sığınmaq vǝ yalnız Ondan yardım dinlmǝkdir. Müsǝlmanların: «Allah bizǝ yetǝr. O, nǝ gözǝl Vǝkildir» sözünün mǝnası: «O, işlǝrimizǝ baxan, idarǝ edǝn vǝ kifayǝt edǝndir».

Allaha tǝvǝkkül dinin yarısı sayılır. Din isǝ yardım dilǝmǝk vǝ ibadǝt etmǝkdir. Tǝvǝkkül isǝ yardım istǝmǝk. Yönǝlmǝk isǝ ibadǝt sayılır. ***«Ǝgǝr inanırsınızsa yalnız Allaha tǝvǝkkül edin».*** *(ǝl-Maidǝ 23).* ***«Artıq möminlǝr yalnız Allaha tǝvǝkkül etmǝlidirlǝr».*** *(Ali İmran 122).* ***«Kim Allaha tǝvǝkkül edǝrsǝ Allah ona yetǝr».*** *(ǝt-Talǝq 3).* ***«Ey Rǝbbimiz! Biz sǝnǝ tǝvǝkkül etdik vǝ Sǝnǝ yönǝldik. Son dönüş dǝ Sǝnǝdir».*** *(ǝl-Mumtǝhinǝ 4).* ***«Sǝn onlardan üz döndǝr vǝ Allaha tǝvǝkkül et. Vǝkil olaraq Allah yetǝr».*** *(ǝn-Nisa 81).* ***«Allah tǝvǝkkül edǝnlǝri sevǝr».*** *(Ali İmran 159).* ***«Allah bizǝ yollarımızı göstǝrdiyi halda, biz nǝ üçün Ona tǝvǝkkül etmǝmǝliyik».*** *(İbrahim 12).* ***«Möminlǝr yalnız o, kǝslǝrdir ki, Allahın adı çǝkildikdǝ*** *(onun heybǝt vǝ ǝzǝmǝtindǝn)* ***ürǝklǝri qorxudan titrǝyǝr, Allahın ayǝlǝri oxunduğu zaman hǝmin ayǝlǝr onların imanlarını daha da artırar, onlar ancaq öz Rǝblǝrinǝ tǝvǝkkül edǝrlǝr. Namaz qilar vǝ verdiyimiz ruzidǝn sǝrf edǝrlǝr».*** *(ǝl-Ǝnfal 2-3).* ***«Ona ibadǝt edin vǝ yalnız Ona tǝvǝkkül edin».*** *(Hud 123).* ***«Allaha iman gǝtirirsinizsǝ Ona tǝvǝkkül edin. Ǝgǝr müsǝlmansınızsa».*** *(Yunus 84).*

***Tǝvǝkkül Dörd Növdür:*** **1.** Uca Allaha olan tǝvǝkkül. **2.** Hansısa bir xeyirin ǝldǝ edilmǝsi vǝ ya zǝrǝrin aradan qaldırılması üçün ölü bir kimsǝyǝ güvǝnmǝk, ona tǝvǝkkül etmǝk. Bu böyük bir şirk olan tǝvǝkküldür. Bu Allahın qadir olduğu bir şeyi Allahdan qeyrisindǝn istǝmǝkdir. **3.** Allahın vǝ insanların qadir olduqları bir şeyi yalnız insanlardan istǝmǝk. Bu kiçik şirkdir. Mǝs: Bir kimsǝ xǝstǝlǝnǝrsǝ vǝ bu xǝstǝliyi ǝsnasında yalnız hǝkimǝ arxalanarsa bu kiçik şirkdir. Çünki hǝkim sǝnin sağalmağın üçün bir sǝbǝbdir. Şǝfa verǝn isǝ Allahdır. **4.** Allahın yaratdıqlarının bacardıqları işlǝrdǝ vǝkil tǝyin etmǝklǝ tǝvǝkkül etmǝk. Ömǝr – *radıyallahu anhu* – deyir ki: «Ǝgǝr siz haqqı ilǝ Allaha tǝvǝkkül etsǝniz Allah sizlǝrǝ ac olaraq gedǝn vǝ tox olaraq qayıdan quşa ruzi verdiyi kimi sizi dǝ ruzilǝndirǝr» . Peyğǝmbǝr – *sallallahu aleyhi vǝ sǝllǝm* - buyurdu: «Kim evindǝn çıxarkǝn Allahın adı ilǝ, Allaha tǝvǝkkül etdim. Allahdan başqa güc vǝ qüvvǝt sahibi yoxdur» deyǝrsǝ ona: «Hidayǝt edildin, qorundun vǝ himayǝ edildin» deyilǝr. Bunun üzǝrinǝ şeytan digǝr bir şeytana: «Hidayǝtǝ yönǝlǝn, qorunan vǝ himayǝ edilǝn bir kimsǝni necǝ sapdırım?» deyǝr .

## VƏHHAB

***ǝl-Vǝhhab*** **–** Bu İsim bǝxş etmǝk, ǝrmǝğan etmǝk, qarşılıqsız vermǝk vǝ ehsan etmǝk mǝnasında gǝlǝn ***Vǝ-Hǝ-Bǝ*** kökündǝn gǝlmǝkdǝdir. ***«Yoxsa sǝnin yenilmǝz qüvvǝt vǝ kǝrǝm sahibi olan Rǝbbinin rǝhmǝt xǝzinǝlǝri onlara mǝxsusdur».*** *(Sad 9).* ***«Ey Rǝbbimiz! Bizi doğru yola yönǝltdikdǝn sonra ürǝklǝrimizǝ şǝkk-şübhǝ*** *(azğınlıq, ǝyrilik)* ***salma! Bizǝ Öz tǝrǝfindǝn bir mǝrhǝmǝt bǝxş et, çünki Sǝn, doğurdan da, bǝxşiş verǝnsǝn!».*** *(Ali İmran 8).* Allah heç bir qarşılıq gözlǝmǝdǝn, heç bir amac güdmǝdǝn bǝxşiş verǝndir. Allahın Vǝhhab isminin olduğuna inanan kimsǝ bütün ehtiyaclarında yalnız Allaha yönǝlmǝli vǝ Ona güvǝnmǝlidir.

---

299 Tirmizi 2344.
300 Tirmizi 3426, «Sǝhih Tirmizi» 3/151.

## VARİS

***əl-Varis* – *«Həqiqətən dirildən də, öldürən də Bizik,*** *(hər şeyə)* ***Varis olan da Bizik!».*** *(əl-Hicr 23).* ***Varis*** **-** hər bir şeyin yox olmasından sonra Bəqi (qalan) deməkdir. Bütün valıqların varlığı Onun əlindədir və yalnız Ona bağlıdır. Onun varlığı isə heç bir varlığa bağlı deyildir.

## VASİ'

***əl-Vasi'*** – ***«Allah genişdir*** *(VASİ)*, ***O*** *(hər şeyi)* ***biləndir».*** *(əl-Bəqərə 115, 247).* Halimi – *rahmətullahi aleyhi* – deyir ki: «***Vasi*** **–** biliyi və gücü çox geniş olan deməkdir. Belə ki, heç bir şey Onu aciz edə bilməz və heç bir şey Ona gizli qalmaz. Onun mərhəməti hər şeyi əhatə edəcək genişliyindədir». O, öncəsiz (əzəli) və sonsuzdur (əbədidir). Onun biliyi bütün bilikləri əhatə edir. Onun gücü bütün güclərdən üstündür.

## NASİR

***ən-Nasir*** – Kömək edən. ***«O, ən gözəl həvadar, ən yaxşı imdada çatandır*** *(NASİR)****».*** *(əl-Ənfal 40).* **"***(Ey möminlər!)* ***Allah yolunda layiqincə cihad edin. O*** *(Öz dini üçün)* ***sizi seçdi və dində sizin üçün heç bir çətinlik yeri qoymadı – atanız İbrahimin dini*** *(dinində olduğu)* ***kimi.*** *(Ey Muhəmməd ümməti!)* ***Allah bundan*** *(Quran nazil olmamışdan)* ***əvvəl də, bunda*** *(Quranda)* ***da sizə müsəlman adını verdi ki, (Qiyamət günü) Peyğəmbər*** *(dinin təbliği, sizin ona iman gətirməyiniz, itaət etməyiniz barədə)* ***sizə, siz də*** *(əvvəlki peyğəmbərlərin Allahın hökmlərini öz ümmətlərinə çatdırdıqları halda)* ***insanlara şahid olasınız. Elə isə*** *(vaxtlı-vaxtında)* ***namaz qılın, zəkat verin və Allaha sığının.*** *(Allah)* ***sizin ixtiyar sahibinizdir. O nə yaxşı ixtiyar sahibi, necə də gözəl imdada yetəndir!".*** *(əl-Həcc 78).* ***Nasir – Nasara*** kök felindən gəlməkdə-dir. Çox yardım edən deməkdir. ***Nasir*** – qorumaq, qoruyan mənasına da gəlir. ***«Əgər Ona üsyan edəcək olsam Allaha qarşı kim məni qoruyar».*** *(əş-Şura 41).* Bəzən də bu kəlimə vermək mənasında da işlədilir. ***Unsuruna Nasaraku-Mullah*** – mənə veriniz, Allah da sizə versin.

Hər bir müsəlman mütləq mənada yardım və zəfərin yalnız Allahdan gələcəyinə inanmalıdır. ***«Əgər Allah sizə yardım etsə artıq heç kimsə sizə qalib gəlməz…».*** *(Ali İmran 160).* Müsəlman uğursuzluğun və məğlubiyyətin də Allahdan gəldiyinə inanmalıdır. Allah üçün uğursuz, məğlub deyilməz. Allah Bədir günü Peyğəmbər, səhabələrə mələklərlə dəstəkləyib yardım etmişdir və düşmənlərinə qarşı onlara zəfər nəsib etmişdir. Möminlərin düşmənləri Allahın və məklərin də düşmənləri-dirlər. Bu üzdən də Allah möminlərə yardım etmişdir. Lakin insanın baş düşməni İblis, nəfsani arzular və istəklərdir. Bunlar insanı daima pislik etməyə sövq edərlər. Allahın görünməyən yardımı isə bunalar qarşıdır. İnsan düşmənlərinə məğlub olarsa müsəlman buna qarşı dinində səbr etməlidir. Yenə də Rəbbinin yardımını görəcəkdir. Çünki düşmənlərinə məğlub olmaqla nəfsi istəklərinə uymamalıdır və bu da onun üçün böyük zəfərdir. Bu isə görünməyən gizli bir zəfərdir. Bu İsmi bilən müsəlman var olan gücü ilə zalıma əngəl olmalı və məzluma yardım etməlidir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qardaşınız istər zalım olsun, istərsə də məzlum ona yardım edin».

Səhabələrdən: «Ey Allahın Rəsulu! Məzluma yardım etdik, zalıma necə yardım edək?» deyə sorudular. Peyğəmbər: «Onu zülm etməkdən çəkindirməklə» .

## NUR

***ən-Nur*** **–** İbn Teymiyyə – *rahmətullahi aleyhi* – (İbn Arabi, İbn Vəziri, Qahtani – *Allah Onlardan Razı Olsun* –) deyir ki: "Bu Ad – İsim olaraq gəlməyib. Qurani Kərimdə İzafə olaraq zikr edilib (Yəni: ***Nurus Səməvəti Vəl Ard***)"[302]. ***Lakin:*** Sufyən b. Uyeynə, Xattabi, İbn Məndə, Həlimi, Beyhəqi, Əsbəhəni, Qurtubi, İbn Qeyyim, İbn Həcər, Səədi, Həmid, Şərbasi, Həsən Sıddıq Xan – *Allah Onlardan Razı Olsun* – bunu İsim olaraq zikr etmişlər. ***"Allah göylərin və yerin nurudur.*** ***(****Kainatı yaradıb ona nur verən, yer və göy əhlinə haqq yolu göstərən xaliqdir).* ***Onun*** *(Peyğəmbərimizin və möminlərin qəlbində olan)* ***nuru, içində çıraq olan bir taxçaya*** *(çıraqdana)* ***bənzər; taxçadakı o çıraq bir qəndilin içindədir, o qəndil isə, sanki parlaq bir ulduzdur. O çıraq nə şərqdə, nə də qərbdə (****aləmin ortasında)* ***olan mübarək bir zeytun ağacından yandırılır.*** *(Şərqdə deyildir ki, günəş batdıqda, qərbdə də deyildir ki, günəş doğduqda qaranlıqda qalsın).* ***Onun*** *(zeytun ağacının)* ***yağı özünə od toxunmasa da, sanki*** *(haradasa)* ***işıq saçır. O, nur üstündə nurdur. Allah dilədiyiniz öz nuruna qovuşdurur*** *(istədiyinə öz nurunu bəxş edib cənnət yolu olan islam dininə yönəldir).* ***Allah*** *(həqiqəti anlaya bilsinlər deyə)* ***insanlar üçün misallar çəkir. Allah hər şeyi biləndir!".*** *(ən-Nur 35).*

## HƏDİ

***əl-Hədi*** **–** Bu İsim Qurani Kərimdə fel olaraq keçir. Doğru yola yönəldən, hidayət verən deməkdir. ***«Şübhəsiz ki, Allah iman gətirənləri doğru yola yönəldər*** *(HƏDİ)****».*** *(əl-Həcc 54).* ***«Rabbinin sənə bir rəhbər*** *(HƏDİ)* ***və bir mədədkar olması kifayət edər».*** *(əl-Furqan 31).* Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Şübhəsiz ki, Allah hidayətə yönəldəndir və fitnəyə salıb azdırandır» .

***Hidayət Iki Cürdür:*** **1.** Yol göstərmək, dəvət etmək və yönəltmək. ***«Sən yalnız bir müjdələyicisən. Hər bir millətin bir yol göstərəni vardır».*** *(ər-Rəd 7).* ***«Sən düz yola yönəldirsən».*** *(əş-Şura 52).* **2.** Qorumaq, dəstəkləməkdir. Bu da yalnız Allaha məxsusdur. ***«Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən. Amma Allah dilədiyini doğru yola salar».*** *(əl-Qəsəs 56).* ***«Onlar Rəblərindən olan hidayət üzərədirlər».*** *(əl-Bəqərə 5).* Həmd ancaq Allahadır, ona həmd edir, ondan yardım və məğfirət diləyirik. Nəfslərimizin şərrindən və pis əməllərimizdən Allaha sığınırıq. Allah kimi hidayətə yönəltmişsə, onu heç kəs azdıra bilməz, kimi də azdırmışsa, heç kəs onu hidayətə yönəldə bilməz .

Hər bir müsəlman Allahın onu yaratdığını bildiyi kimi, mərhəməti ilə hidayətə yönəldənin və ya ədaləti ilə saptıranın da Allah olduğunu bilməsi lazımdır. Bu bilikdən sonra daima Allahdan özünə hidayət istəməsi və İslam üzərə ölməsini tələb etməli və bunun üçün də dua etməlidir. ***«Ey iman gətirənlər! Sizə həyat verən şeylərə çağırıldığınız zaman Allah və Rəsuluna icabət edin. Bilin ki, Allah insan ilə qəlbi***

---

[301] Buxari 3/98.
[302] "Məcmuul Fətava" 5/74.
[303] İmam Məlik «Muvatta» 1729.
[304] Müslim 868.

***arasına girər».*** *(əl-Ənfal 24).* ***«Allah kimi düz yola yönəltmək istəsə, onun köksünü İslam*** *(dini)* ***üçün açıb genişləndirər, kimi azdırmaq istəsə onun ürəyini daraldıb sıxıntıya salar. O, sanki göyə çıxar. Allah iman gətirməyənlərə pisliyi belə edər».*** *(əl-Ənam 125).* Allah imanı kimin qəlbində yaradırsa ancaq o, hidayət tapır. Nə peyğəmbər, nə bir başqası buna müdaxilə edə bilməz. ***«Sənə düşən yalnız təbliğ etməkdir».*** *(əş-Şura 48).* ***«Rəbbimiz hər şeyə öz surətini verən və sonra da doğru yolu göstərən Allahdır».*** *(Ta ha 50)* ayəsində hidayət ilə bütün canlıları əhatə edən hidayət qəsd edilmişdir. Əgər bu hidayət olmasaydı kişilər qadınlara yönəlməz, heyvanlar otlaqlara getməz, bal arıları pətəklərinə yönəlməz və s. sayılmayacaq qədər çoxdur» .

## TAYYİB

***ət-Tayyib*** - Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Şübhəsiz ki, Allah ***Tayyibdir*** (pak və nöqsansızdır) və Tayyib olandan başqasını da qəbul etməz. Allah Peyğəmbərlərinə əmr etdiyi şeyin eynisini möminlərə də əmr etmişdi. Allah buyurur: ***«Ey Peyğəmbərlər! təmiz və halal nemətlərdən yeyin və yaxşı işlər görün»*** *(əl-Muminun 51).* Yenə Allah buyurur: ***«Ey iman gətirənlər! Sizə verdiyimiz ruzilərin təmiz və halalından yeyin».*** *(əl-Bəqərə172)»* .

## İLHAD

***İlhad*** – dildə «əyilmək» deməkdir. ***İstilahi Mənası*** – inanılması və ya edilməsi lazım olan şeydən başqa yana əyilmək deməkdir. İki növdür:

**1.** Allahın İsimlərində ilhad. Bu özü də dörd qismə bölünür.

1) Tətilçilərin etdikləri kimi İsimlərin hər hansı birini və ya bunların göstərdikləri sifətləri inkar etmək.

2) Təşbihçilərin etdikləri kimi Allahın İsimlərini və Sifətlərini məxluqatın isim və sifətləri kimi olduğunu qeyd etmək (bənzətmək).

3) Allahın İsimlərini bütlərə qoymaq. Məs: Allahın ***əl-İlah*** adını, ***əl-Lat*** adı ilə dəyişərək öz bütlərinə qoymuşlar. ***əl-Lat*** – Taif şəhərində ağ dağın adı idi. ***əl-Əziz*** adını, ***əl-Uzza*** – İbn Cərir – *rahmətullahi aleyhi* – deyir: «Məkkə ilə Taif arasında, Nəxl adlanan yerdə ağac adı idi». ***əl-Mənnan*** adını, ***əl-Manat*** – Məkkə ilə Mədinə arasında, Hudeydə adlanan yerin adı idi.

4) Allahın özü-özünə vermədiyi bir qisim İsimlərlə Allahı adlandırmaq. Məs: Yəhudi və Xristianların dediyi kimi Ata, oğul və bizim dilimizdə işlənən o, kişiyə qurban olum və s. ***«Bir deyin görək Lat və Uzza nəyə qadirdir. Digəri üçüncüsü olan Manat da həmçinin… O, bütlər sizin və atalarınızın qoyduqları adlardan başqa bir şey deyildir. Allah onlara dair bir dəlil endirməmişdir».*** *(ən-Nəcm 19-23).*

**2.** Allahın ayələrində ilhad. Bu da iki qismdir:

1) Şəri ayələrdə ilhad - bu ayələri təhrif etmək, ayələrin bildirdiyi xəbərləri yalanlamaq ya da bu ayələrin hökümlərinə qarşı çıxmaq ilə olur.

2) Kovni ayələrdə ilhad – bu ayələri Allahdan başqasına nisbət etmək və ya bu ayələrdə bir ortağı (şəriki), köməkçisi olduğuna inanmaqdır.

---

[305] Qurtubi 1/380-383.
[306] Müslim “Kitabu Zəkat” 3/85, H. 1015.

İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir: «Allahın İsimlərində ilhad (əyriliyə, inkara sapmaq) o, İsimləri həqiqətləri və mənalarını onlar haqqında sabit olmuş haqq mənalarından uzaqlaşdırmaq deməkdir. Bu kəlmə meyl etmək, sapmaqdan alınmışdır. Həmçinin «***Ləhadə***» kökü də buna dəlalət etməkdədir. ***Ləhd*** – ortasından yana doğru qazılmış qəbrin yan tərəfində yarıq açmaq deməkdir. Haqdan meyl edən və haqq olmayan şeyləri dinə salan kimsə haqqında da işlədilən Mulhid kəlməsi də buradan gəlməkdədir.

# İSTİVA

***İstiva*** – Allahın feli sifətlərindəndir. ***İstiva*** – üstə olmaq, yüksəlmək, çıxmaq deməkdir. Allahın yeddi səmanın üstündə yaratdıqlarından ayrı olaraq Ərşin üzərunə istiva etdiyinə və elmi ilə hər bir şeyi əhatə etdiyinə iman gətirilməlidir. Qatadə İbn ən-Numan - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Allah yaratmağı qurtardıqdan sonra Ərşin üzərinə istiva etdi» .

Əbu Muhəmməd AbdulQadir əl-Ceylani : «Hər cür əskikliktən və qüsurdan münəzzəh olan Allah, yüksəklik yönündə (yuxarı tərəfdə) Ərşinə İstiva edəndir, mülkü əhatə edəndir» sözlərini açıqlayaraq demişdir: «Allahın hər yerdə olduğunu qeyd etmək düzgün deyildir. Əksinə Allah göydə, Ərşə İstiva etmişdir deyilməsi daha mötəbərdir. Allah buyurur: ***«Rahmən ərşə istiva etdi»****. (Ta ha 5).* İstiva kəlməsini hər hansı bir təvilə yol vermədən olduğu kimi işlətmək lazımdır. Belə ki, bu İstiva Ərşə edilən Zatı İstivasıdır. Nə Mucəssimə, nə də Kərramiyyənin dediyi kimi Ərşin üzərinə oturmaq və onunla doğrudan-doğruya təmasda olmaq (yəni ona, ərşə doğrudan) dəymək mənasında deyildir. Nə də Mutəzilənin dediyi kimi (Ərşi) istilə (***İstəvlə*** – zəbt etmək, hökmü altına almaq) və ona qələbə çalmaq mənasındadır. Nə də Əşariyyənin dediyi sifətlərin yüksəkliyi və ucalığı manasındadır. Çünkü Quran və Sünnədə olan dəlillər İstiva sözüylə bunları qəsd etməmişlər». Əhli Sünnə Allahın ərşinin üstündə olduğu inancında birləşmişlər (icma etmişlər). Onlardan heç biri Allahın Ərşin üzərində olmadığını söyləməmişlər. Heç kimsənin onlardan bu mənada nə nass, nə də zahir olaraq bir söz nəql etməsi mümkün deyildir .

Bu kəlməni Müxaliflərin yozduqları kimi zəbt etdi, hökmü altına aldı, qüdrəti ilə və s. mənalar ilə dəyişməməliyik. ***İstiva*** – məlumdur, keyfiyyəti isə məchuldur. Ona iman gətirmək isə vacibdir. Əbu Nuaym Cəfər İbn Abdullah deyir ki, biz İmam Məlik – *rahmətullahi aleyhi* – ın yanında idik. Bir nəfər: «Ey Abdullahın atası! Allah Ərşə necə istiva etdi?» İmam Məlik – *rahmətullahi aleyhi* – bu sualı eşidəndə bərk qəzəbləndi. Başını aşağı salaraq, əlindəki çubuqla yerə sürtərək fikrə daldı. Sonra başını qaldırıb əlindəkini atdı və: «Necəliyi ağılla dərk olunmaz. İstiva Allah üçün məlumdur (yəni bilinməz deyildir). Buna iman vacib, bu haqda sual vermək bidətdir. Səni də bir bidətçi

---

[307] Zəhəbi "Uluv" 52, İbn Qeyyim "İctimai Cuyuşil İslamiyya2 s. 54, əl-Albani "Muxtəsər Uluv" s. 98, "Səhih". Başqa rəvayətdə: Allah sevdiyi şeyləi yaratmağı bitirdikdə Ərşə İstiva etdi. Təbəri 1/240-242, 607, İbn Məndə "Kitabu Tovhid" 3/93-94, 486, Suyuti "Durrul Mənsur" 1/94-98.

[308] İmam, alim, zahid, arif, Şeyxul-İslam Əbu Muhəmməd Muhyiddin AbdulQadir İbn Əbu Saleh Abdullah İbn Cəngi Dust əl-Ceyli əl-Hənbəli. Bağdadın şeyxi h. 471-ci il Ceylan qəsəbəsində doğulmuşdur. H. 571-ci ildə vəfat etmişdir. Əsərləri: «əl-Gunyə», «Tuhfetul Muttaqin», «Səbilul Arifin». Bax: İbn Rəcəb «Zeylu Tabaqatil Hanabilə» 1/290,310, «ən-Nucmuz Zahirə» 5/85,86, «Şəzəratuz Zəhəb» 4/119,202.

[309] «əl-Gunyə» s. 56,57, İbn Teymiyyə «Məcmuul Fətava» 5/85,86, Zəhəbi «Uluvv» (müxtəsər s. 284), İbn Qeyyim «İctimaul Cuyusil İslamiyyə» s. 175.

kimi görürəm və bu adamın qovulmasını əmr etdi» . İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Allaha verilən İsim və Sifətlər tamamən ***Tovqifidir*** – Allah və Rəsulunun bildirməsi ilə bilinə bilər» . İmam İshaq İbn Rahaveyh – *rahmətullahi aleyhi* – deyir ki: «Elm əhlinin inancına görə O, ərşə istiva etmişdir. Yeddinci yerin dibindəki hər şeyi də bilir» .

***«İstiva Bilinməz Deyildir»*** sözü: Yəni dildə mənası bilinməz deyildir. Çünki mənası yüksəklik, üstə olmaq, yüksəlmək, çıxmaq deməkdir.

***«Necəliyi Ağılla Dərk Olunmaz»*** sözü: Ağıllarımızla Allahın ərşinə istivasının necəliyini anlamağımız mümkün deyildir, deməkdir. Bunun yolu ancaq və ancaq nəqli dəlillər olan Quran və Sünnə (hədislərdir). Quran və Sünnədə Allahın ərşinə istivasının necəliyini bildirən hər hansı bir dəlil yoxdur. Buna görə də bu haqda bizdə dəlil olmadığı üçün bu mövzuda susub danışmamağımız daha məsləhətlidir. Sual ola bilər ki: «Allahın Sifətlərinin necəliyi varmıdır?». Cavab olaraq deyirik ki: «Allahın Sifətlərinin mənaları tərəfimizdən bilinməkdədir. Necəliyi isə bizim üçün bilinməzdir. Çünki Allah bizə, bu Sifətlərin mənalarını bildirmiş, necəliyini isə bildirməmişdir. Sələf mütləq olaraq necəliyi rədd etməmişdir. Əsla, çünki bu bir tətildir. Allahın Sifətlərinin necəliyi vardır. Fəqət bu necəlik bizim üçün bir bilinməzdir. Çünki bir şeyin necəliyi, yalnız o, şeyi görməklə, ya bənzərini görməklə və ya onun haqqında gələn doğru xəbərlərlə bilinə bilər. Bu yolların heç biri Allahın Sifətləri haqqında mövcut deyildir. Sifətlər haqqında söz, zat haqında sözün bir budağıdır. Biz Allahın zatının necəliyinə varmadan qəbul etdiyimiz kimi, Sifətlərini də eyni onun kimi necəliyinə varmadan qəbul etməliyik. Sələflər deyirlər ki, müxaliflərdən biri sənə: «Allahın sifətlərindən hər hansı birinin necə olduğunu soruşarsa» ona belə de: «Yaxşı, Allah zatıyla necədir?» Heç şübhəsiz ki, Allahın zatının necəliyinə varmayacaqdır. O, zaman ona de: «Onun zatının necəliyini demək mümkün olmadığı kimi, Onun Sifətlərinin necəliyini deməkdə mümkün deyildir. Çünki sifətlər zata tabedirlər.

***«Buna İman Vacibdir»*** sözü: Allahın özünə yaraşır bir şəkildə Ərşinin üzərinə İstiva etdiyinə inanmaq vacibdir. Çünki Allah özünü belə tanıtmışdır.

***«Bu Haqda Sual Vermək Bidətdir»*** sözü: Bu isə İstivanın necəliyi haqqında sual verməninin bidət olduğu mənasına gəlməktədir. Çünki belə bir sualı Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - və səhabələrin zamanında verilməmişdir.

Allah, Qurani Kərimdə **7** yerdə: əl-Əraf **54**, Ta ha **5**, ər-Rad **2**, Yunus **3**, əs-Səcdə **4**, Furqan **59**, əl-Hədid **4**-də ***Alə*** – üzərinə ön qoşması ilə, ***«Rəhmən ərşin üzərinə yüksəldi»***. *(Ta ha 5).* İki yerdə isə: əl-Bəqərə **29**, Fussilət **11**-də ***İlə*** – tərəf ön qoşması ilə, ***«Sonra səmaya tərəf üz tutaraq»***. *(əl-Bəqərə 29)*-də İstiva etdiyini bəyan etmişdi.

Müxaliflər İstiva kəlməsini bir çox mənalar ilə dəyişmişlər. Bunlardan ən məşhuru ***İstiva*** – sözünə ***Lə*** – şəkilçisi artıraraq ***İstəvlə*** – zəbt etmək, hökmü altına almaq mənasıdır. Heç bir qrammatika alimləri bu sözlərin eyni məna ifadə etdiklərini qeyd etməmişlər. ***İstiva*** – felin səkkizinci fəslinə aiddir və kökü ***Sin-Vav-Yə*** – dən ibarətdir.

---

[310] Bu Söz İmam Əbu Hənifə – *rahmətullahi aleyhi* – dən də rəvayət edilir: "Mirkatul Məfatih Mişkətul Məsabih" 8/251, "Firəhul Emali" s.31, İbn Qudamə "İsbat" 104, Əbu Nuaym "Hilyətul Əvliyə" 6/325, Darimi "Raddu Alə Cəhmiyyə" s. 33, Lələkai "664, Beyhəqi "Əsmə" 408, 2/150-151, İbn AbdulBərr "Təhmid" 7/151, Zəhəbi "Uluv" s. 141, İbn Teymiyyə "Məcmuul Fətava" 5/365, İbn Həcər "Fəthul Bəri" 13/417, əl-Albani "Muxtəsər Uluv" 141, "Əqidətul Təhaviyyə" s. 281,302. Bu söz Ummu Sələmə – *radıyallahu anhu* – dan Movquf və ya Mərfu əsər olaraq rəvayət edilir. Lələkai "Usulu Sünnə" 663. Lakin daha çox İmam Məlik – *rahmətullahi aleyhi* – in sözü kimi məşhurdur. *Doğrusunu Allah Bilir!*

[311] Bədaiul Fəvaid 1/166.

[312] İmam Zəhəbi «Uluvv».

***Əlif-Tə*** artırılaraq əmələ gəlib. ***İstəvlə*** – felin onuncu fəslinə aiddir və kökü ***Vav-Ləm-Yə*** – dən ibarətdir. ***Əlif-Sin*** artırmaqla düzəlir.

Şairin: ***Qad İstəvə Bişrun Aləl Iraqi***
***Min Ğayri Səyfin Və Dəmin Mihraqi***
Bişr İraqı İstilə (zəbt etmdi, hökmü altına aldı),
Qılıncsız qan tökmədən.

Sözlərinə gəlincə bu beytin sənədi olmadığı kimi, onu kimin söylədiyi və ondan bu beyti kimin nəql etdiyi bilinməməkdədir. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir: «Bunun ərəb şeri olduğuna dair səhih bir nəql yoxdur. Dil (qramatika) imamlarından bir çoxu onu inkar etmiş və dildə bilinməyən uydurma bir beyt olduğunu söyləmişlər. Bilindiyi kimi Rəsulullah – *sallallahu aleyhi və səlləm* - bir hədis dəlil olaraq irəli sürülərsə şübhəsiz ki, onun səhih olması lazımdır. O, halda isnadı belə bilinməyən və dil imamlarının inkar etdiyi bir beytin nə hökmü ola bilər? Əbul Muzəffərin «***əl-İfsah***» adlı əsərində Xəlilə: «Dildə «***İstiva***» kəlməsinin «***İstəvlə***» mənasına gəldiyinə heç rast gəldinmi?» deyə soruşdular. O: «Bu həm ərəblərin bilmədiyi bir şeydir, həm də dillərində belə bir şey caiz (qəbul) deyildir. Xəlil dildə imamdır. O, halda İstivaya (dildə) bilinməyən bir məna yükləmək, batil bir məna yükləmək adlanır» .

Həmçinin bizə Qurani Kərimdən göründüyü kimi, sonra Ərşə yüksəldi. Müxaliflərin dediyi kimi olsa, sonra hökmü altına aldı – belə çıxır ki, əvvəl Ərş Allahın hökmü altında deyildi, həmçinin hökmü altına almaq acizliyin əlamətidir. Allah əvvəl aciz olub, sonra güc toplayaraq öz hökmü altına alıb. İkinci tərəfdən əgər Allah, onların dediyi kimi Ərşi hökmü altına alıbsa bəs qalan məxluqlar necə? Biz bilirik ki, Allah göyləri və yeri yaratmamışdan əlli min il əvvəl də hər bir şey Allahın hökmü altında olub və olacaqdır. İstivanın həqiqətini inkar edən hər kəs Muattıl olur. Yenə istivanı yaradılmışların bir-birlərinə olan istivasına bənzədən kimsə də Müşəbbih olur. Hər kimdə Allahın İstivasının bənzəri heç bir şey yoxdur deyərsə o, Muvahiddir (Tövhid əhlidir), Munəzzihdir (Allahı əskiklik və qüsur sifətlərindən təmizliyəndir).

## ƏRŞ VƏ KURSİ

Əhli Sünnə Vəl Cəmaat - Ərş və Kursinin də haqq olduğuna inanırlar. ***Ərş*** – kəlməsi Qurani Kərimdə **21** yerdə qeyd olunur. ***«Şanlı ərşin sahibi də odur».*** *(əl-Buruc 15).* ***«Ərşin sahibi olan Allah».*** *(əl-Mumin 15).* ***«O, böyük ərşin sahibi olan Allahdan başqa ilah yoxdur».*** *(ən-Nəml 26).* ***«O, uca və kərim olan ərşin sahibidir».*** *(əl-Muminun 116).* ***Ərş*** *– Taxt deməkdir.* ***«Onun çox böyük əzəmətli ərşi*** *(taxtı)* ***də vardı».*** *(ən-Nəml 23).* ***«Yusif ata-anasını taxt*** *(öz taxtının)* ***üstünə qaldırdı».*** *(Yusif 100).*

Ərş mələklərin daşıdığı və tutacağı taxtdır. Ərşin tutacağı vardır. Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurur: «Qiyamət günü İnsanların çaşqın olan vaxtı ilk oyanan mən olacağam. Bir də baxıb görəcəm ki, Musa - *əleyhissəlam* - Ərşin dirəklərindən birindən tutub» . Aləmin üzərində Qübbə formasındadır Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «…Yazıqlar olsun sənə! Sən Allahın (böyüklüyünün və ucalığının) nə olduğunu bilmirsən? Şübhəsiz ki, Onun Ərşi göylərin (Başqa rəvayətdə: Yerlərin) üstündədir. (Allahın Ərşi) belədir deyib: «(Peyğəmbər –

---

[313] «Məcmul Fətava» 5/146. İbn Qeyyim "İctimaul Cuyuşil İslamiyya" s. 197-202 adlı əsərində İstiva barəsində bir çox şairlərin şerlərini də vermişdir. "Şərh Əqidətul Vasitiyyə" 1/378-379.
[314] Buxari 6991, 7427.

*sallallahu aleyhi və səlləm* - bu an) barmaqlarıyla işarə edərək: «Eynilə Qübbə kimidir. Kursünün yeni düzəldilmiş Dəvə palanının minənin ağırlığı (səbəbilə) qıcırdaması kimi qıcırdaması vardır» dedi .[316] Bütün məxluqatın tavanıdır. Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Allahdan Cənnəti istədiyiniz zaman Firdovsu diləyin. Çünkü o, Cənnətin orta yerində ən yüksək yerdədir. Onun üstündə Rahmənin Ərşi vardır. Cənnətin çayları oradan qaynayır» . Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: "Allah bütün məxluqatı xəlq etməyi təqdir etdiyi zaman (Başqa rəvayətdə: Məxluqatı xəlq etməmişdən qabaq) Ərşinin üzərində, yanında olan (Başqa rəvayətdə: Kitabda – Lövi Məhfuzda) bunu qeyd etmişdir: Rəhmətim Qəzəbimi keçmişdir (Başqa rəvayətdə: Allah məxluqatı xəlq etdiyi zaman Öz nəfsi yanında: Rəhmətim Qəzəbimə qələbə çalmışdır[318])"[319].

***Ərş*** – kəlməsini mülk, qüdrət kimi təhrif (dəyişmək) etmək istəyənlər bu ayələrə nə deyirlər. ***«Həmin gün Rəbbinin ərşini onların** (başı) **üstündə səkkiz mələk daşıyacaqdır».*** *(əl-Həqqa 17).* ***«Onun ərşi suyun üzərindədir».*** *(Hud 7).* İmran İbn Huseyn – *radıyallahu anhu* – rəvayət edir ki, Bəni Təmim qəbiləsindən bir qrup insan Rəsulullah – *sallallahu aleyhi və səlləm* – ın yanına gəldilər. Peyğəmbər: "...(əzəldən) Allah vardı və Ondan öncə heç bir şey yox idi. Ərşi də su üzərində idi. Sonra Allah göyləri və yerləri yaratdı. Sonra hər bir şeyin zikrini təqdir etdi (Başqa rəvayətdə: Əbu Rəzin əl-Ukayl – *radıyallahu anhu* – deyir ki: "Ey Allahın Rəsulu! Rəbbimiz bu məxluqatı yaratmamışdan əvvəl harada idi?". Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «O, tək başına heç bir şey olmadan O, vardı. Altı hava, üstü hava (boşluq) idi. Ərşi də su üzərində yaratdı[320])»[321]. Abbas İbn AbdulMuttalib – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - səhabələrə buyurdu: «Bilirsinizmi, səma ilə yer arasında nə qədər məsafə var?» Səhabələr: «Allah və Rəsulu daha gözəl bilir». Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Onlar arasında məsafə **500**-ildir. Həmçinin hər bir səma ilə (o, biri səma qatı arası) **500**-ildir. Hər bir səmanın qalınlığı da **500-il** yürümə qədərdir. Yeddinci səma ilə Ərşin arasında

---

[315] Darimi "Rəddu Alə Bişri Mərisi" s. 105, İbn Əbi Asim "Sünnə" 55-576, İbn Huzeymə "Tovhid" s. 103-104, Təbərani "Kəbir" 1547, Darakutni "Sifət" s. 50-51, İbn Məndə "Tovhid" s. 188, 643, Ləlakai 656, Beyhəqi "Əsmə" s. 417-418, 2/159, Zəhəbi "Uluv" s. 37-39, İbn Kəsir "Bidayə" 1/7-439, əl-Albani "Silsilə Daif" 2639, "Ziləlul Cənnə" 575,576, "Mişkət" 5727, "Daif Sünən Əbu Davud" 1017, "Şərh Əqidətul Təhaviyyə" s. 278,295, əl-Albani – *rahmətullahi aleyhi* – deyir ki: "Ərşin (Kursinin) qıcırdaması barədə Səhih rəvayət yoxdur". "Mişkət" 3/1596, "Silsilə Daif" 2/257, 2/307.

[316] İbn Kəsir – *rahmətullahi aleyhi* – nin söz açdığı hədisin mətini belədir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına bir qadın gələrək: "Allahın məni Cənnətə salması üçün dua et" dedi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - Rəbbinə təzim etdikdən sonra buyurdu: Allahın Kursüsü (Başqa rəvayətdə: Ərşi) göyləri və yeri əhatə etmişdir. (Allah Kurüsün üzərinə oturar və ondan (Başqa rəvayətdə: Ərşdən) dörd barmaq belə boş yer qalmaz) Kursünün yeni düzəldilmiş Dəvə palanına minənin ağırlığı (səbəbilə) qıcırdaması kimi qıcırdaması vardır". İbn Kəsir 1/318, "əl-Bidayə" 1/11, İbn Əbi Asim "Sünnə" 574, Bəzzar "Musnəd" 1/317, İbn Həcər "Məcmuuz Zəvaid", Əbu Yəla "Musnəd", İbn Huzeymə "Təhmid" s. 106, Təbəri 5798, Ömər – *radıyallahu anhu* – yoluyla "Mərfu" olaraq Peyğəmbərdən Darimi "Rəddu Alə Bişri Mərisi" s. 74, Əhməd "Sünnə" 585, 593, Həkim, Tirmizi "Raddu Alə Mutəzilə", İbnul Covzi "Mutənahiyə" 1/4, Zəhəbi "Uluv" s. 39, Hədiz həm mətin, həm də sənədinə görə Muzadaribdir, əl-Albani "Silsilə Daif" 2/256-257, 866, "Ziləlil Cənnə" 1/252, 574 "Munkər" hədis. ***Həçinin*** **–** Əbu Musa əl-Əşari – *radıyallahu anhu* – yoluyla: "Kursi iki ayağın qoyulduğu yerdir. Kursünün palanın qıcırdaması kimi qıcırdaması vardır". Əhməd "Sünnə" 588, Təbəri 5790, İbn Məndə "Raddu Alə Cəhmiyyə" s. 46, Beyhəqi "Əsmə" s. 404, 2/148, Zəhəbi "Uluv" s. 84, İbn Həcər "Təhzibut Təhzib" 7/356, əl-Albani "Silsilə Daif" 2/306,307, "Muxtəsər Uluv" s. 124.

[317] Buxari 6987, Tirmizi 2530, əl-Albani "Səhih".

[318] Tirmizi 2/271, Əhməd 2/433, İbn Məcə 4295, əl-Albani "Səhih Silsilə" 1629.

[319] Buxari 6986, 7115, Müslim 2751.

[320] Tirmizi «Tuhvətul Əhvəzi» 8/528, İbn Məcə «Muqəddimə Fi Mə Ənkərat Həsən əl-Cəhmiyyə», Əhməd «Musnəd» 4/11, əl-Albani əs-Sunnənin təhricində 216 zəif.

[321] Buxari 6982.

dəniz vardır (Başqa rəvayətdə: Yeddinci səma ilə kürsi arasında məsafə **500**-ildir. Kürsi ilə dəniz arasında da **500**-ildir. Ərş isə dənizin üzərində yerləşir. Allah isə Ərşin üzərindədir[322]). Bu dənizin dibi ilə səthi arası səma ilə yer arasında olan məsafə qədərdir. Allah bunların hamısından yuxarıdadır. Adəm övladlarının heç birinin əməli ondan gizli qalmaz»[323].[324] Mucahid – *rahmətullahi aleyhi* – deyir ki: "Yeddinci səma ilə Ərş arasında **70000** min hicab var. Musa - *əleyhissəlam* - yaxınlaşmağa davam edirdi. Hətta o, qədər yaxınlaşdı ki, Musa və Ərş arasında bir hicab qaldıqda o, öz yerini gördü və (Qədəri) yazan qələmin cırıltısını eşitdikdə buyurdu: "Ya Rəbbim! İzin ver Sənə baxım"[325]. Həsənul Bəsri – *rahmətullahi aleyhi* – deyir ki: "Məxluqatdan İsrafil - *əleyhissəlam* - qədər Allaha yaxın olan məxluq (mələk) yoxdur. Onunla Rəbbi arasında **70** hicab vardır və hər bir hicab (arasında) **500**-illik məsafə vardır. İsrafil - *əleyhissəlam* - bütün bunlardan yüksəkdədir. Onun başı Ərşin altında, çiyinləri isə yeddi səmanın sonundadır"[326].

Rəhmanın Ərşinin ağırlığı, böyüklüyü haqqında Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurur: «Yaratdıqlarının sayı qədər, özünün razı olacağı qədər, Ərşinin ağırlığı qədər və kəlmələrinin sayı qədər Allaha həmd edərək o, pak və nöqsansızdır» . Rəsulullah – *sallallahu aleyhi və səlləm* - sıxıntı anlarında buyurardı: «Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur. O, çox böyükdür, Həlimdir. Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur. O, böyük Ərşin Rəbbidir. Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur. Göylərin Rəbbidir, yerin Rəbbidir. Kərim olan Ərşin Rəbbidir» . Cabir – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Sad b. Muaz – *radıyallahu anhu* – barəsində buyurdu: "Onun ölümünə görə (Rəbbimin) Ərşi titrədi, səma qapıları açılaraq oradan **70** min mələk (enərək onun cənazəsində) iştirak etdi. İlk öncə (Qəbir) onu sıxdı, sonra isə bu sıxıntıdan qurtardı» .

Kursi Ərşdən sonra gəlib, ondan ayrıdır. Kursi dildə – döşək və ya üzərində otrulan hər şey deməkdir. ***«And olsun ki, biz Süleymanı imtahana çəkdik. Taxtının üstünə bir cinn oturtduq*** *(və ya ruhsuz bir cəsəd atdıq).* ***Sonra o*** *(peşman olub tövbə etdi və yenidən öz mülkünə taxtına)* ***qayıtdı».*** *(Sad 34).* Allahın Kursisi isə onun iki ayağının qoyduğu yerdir. İbn Abbas – *radıyallahu anhu* – dedi: «Kursi iki ayağın qoyulduğu

---

[322] İmam Zəhəbi "Muxtəsər Uluv" 103, Darimi "Raddu Cəhmiyyə" 26, İbn Huzüymə "Tövhid" 105,376, Beyhəqi "Əsmə" 301.
[323] Tirmizi 3317, Əbu Davud 4723-4725, Əhməd 1/206-207, İbn Məcə 193, Beyhəqi "Əsmə" 401, əl-Albani "Zəif" 1247.
[324] Bu hədisi bu cür ləfsdə göstərilən qaynaqların heç birində tapa bilmədim. Bu qaynaqlarda gələn və əl-Albaninin "Zəif" 1247-adlandırdığı hədisin ləfsi budur: Abbas İbn AbdulMuttalib ﷺ rəvayət edir ki, Bathada Rəsulullah – *sallallahu aleyhi və səlləm* - ilə bərabər bir məclisdə isim. Bir bulud keçdikdə Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: "Buna nə ad verirsiniz?". Orada olanlar: "Səhab (bulud)" dedilər. Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: "Muznə" deyirsinizmi? Onlar: "Bəli" dedilər. Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: "Bəs – Anan" deyirsinizmi? Oradakılar: "Bəli, elə də deyirik" dedilər. Peyğəmbər: "Yerlə səma arasında nə qədər məsafə olduğunu bilirsinizmi?" deyə buyurdu. Onlar: "Xeyr" bilmirik. Peyğəmbər: "Yer ilə Səma arasında **71, 72** və ya **73-illik** məsafə vardır. Bunun üzərində olan ikinci səma da eynilədir. (Beləcə bütün səmaları zikr etdikdən sonra) buyurdu: Yeddinci səma üzərində elə bir dəniz vardır ki, səthi ilə dibi arasında olan məsafə iki göy arasında olan məsafə qədərdir. Sonra onların üzərində səkkiz (Mələk - *Allah Daha Doğru Bilir*) vardır ki, onların dıqnaqları ilə belləri (diz qapaqları) arasında olan məsafə iki səma arasında olan məsafə qədərdir. Onların bellərində altı ilə üstü iki səma arası məsafə qədər olan Ərş vardır. Uca və Böyük olan Allah bunların üzərindədir".
[325] Beyhəqi "Əsmə" 508, Zəhəbi "Uluv", əl-Albani "Səhih".
[326] İbn Qudamə" İsbat" 111, Zəhəbi "Uluv", Bəğavi "Təfsir".
[327] Müslim.
[328] Buxari, Müslim.
[329] Buxari 3808, Səhih Sünən Nəsəi 1942.

yerdir. Ərşin böyüklüyünü isə Allahdan başqa heç kəs bilməz» . O, da Qurani Kərimdə yalnız bir yerdə qeyd olunur. ***«Onun kursisi göyləri və yeri əhatə etmişdi».*** *(əl-Bəqərə 255).* Kursinin elm olması haqda bəzi alimlər hədislər də gətirirlər. Lakin bu hədislərin hamsı zəifdir .

***Ərş*** – ilə Kursinin müqayisəsini Əbu Zərr – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - belə izah edir. «Yeddi qat göy və yeddi qat yer, Allahın Kusisi yanında geniş səhraya atılmış bir halqa kimidir. Ərşin Kursiyə üstünlüyü isə bu geniş səhranın halqaya üstünlüyü kimidir» . İbn Zeyd – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Yeddi qat göy və yeddi qat yer Kursi ilə müqayisədə qalxanın içərisinə atılmış yeddi dirhəmə oxşayır» . İbn Abbas – *radıyallahu anhu* – dedi: «Yeddi səma və yeddi yer Rəhmanın əlinin içində (ovcunda) sizdən birinizin əlinin içində tutduğu xardal dənəsinə oxşar».

Sələflər deyirlər ki, müxaliflərdən biri sənə: «Allahın Ərşinə İstivasını, Ərşin üzərində, üstündə olmasıyla açıqlayırsınızsa deməli Allahı üstündə daşıyacaq bir taxta (Ərşə) möhtac olduğunu irəli sürmüş olursunuz». Buna cavab olaraq belə deyirik: «Allahın Ərşə də Kursiyə də ehtiyacı yoxdur. Allah Ərşə ehtiyacı olduğu üçün İstiva etməmişdir. Allah Ərşə də, başqa şeylərə də möhtac olmaqdan münəzzəhdir. Allahın böyüklüyünü, qüdrət, qüvvət və zənginliyinin mükəmməlliyini bilən hər kəs Allahı üstündə daşıyacaq bir taxta ehtiyacı olduğunu ağlının ucundan belə keçirməz. Necə keçirsin ki? Allahın izzəti və uluhiyyəti Ərş və Kursidən də çox ucadır. Ərş də, Kursi də və digər yaradılmışlar da Allaha möhtacdırlar və Onun qüdrəti və hökmü ilə daşınmaqdadır. ***«Əlbəttə, Allah aləmlərə möhtac deyildir».*** *(Ali İmran 97).* ***«Ey insanlar! Siz Allaha möhtacsınız. Allah isə** (heç nəyə)* ***möhtac deyildir».*** *(Fatir 10).* Bütün bu yaradılmışlar O, olmadan nə var ola bilirlər, nə də ayaqda dura bilirlər. Necə ki, göyün və yerin Onun əmri ilə ayaqda durması Onun (varlığının və qüdrətinin) əlamətlərindəndir. ***«Göyün və yerin Onun əmrində durması… Onun qüdrət əlamətlərindəndir».*** *(ər-Rum 25).* İmam Təhavi – *rahmətullahi aleyhi* – Əbu Hənifə – *rahmətullahi aleyhi* – nin Ərş və Kursi barəsində olan inancını bu sözlərlə ifadə edir: "Ərş və Kursi haqdır. Allahın Ərşədə, aşağı olan şeylərə də ehtiyacı yoxdur. Allah hər şeyi və bunun üzərindəki Ərşi də (elmi ilə) əhatə etmişdir. Özünü əhatə etməkdən isə

---

[330] İbn Abbas – *radıyallahu anhu* – nun sözü olaraq "***Movquf***" səhihdir: Əhməd "Sünnə" 586,1020,1021, İbn Əbi Şeybə "Kitabul Arş" 61, İbn Huzüymə "Tovhid" s. 107, 248, Həkim "Mustədrək" 2/310, 3116, Darakutni "Kitabul Nuzul" 36,37, 49-50, Təbəri 5789, Darimi "Rəddul Mərisi" s. 67,71-73, İbn məndə "Rəddul Cəhmiyyə" 15, Beyhəqi "Əsmə" s. 404, 2/148, İbn Kəsir 1/317, Zəhəbi "Uuv" 45, Əhməd Şakir "Umdətul Təfsir" 2/162, Heysəmi "Məcmuus Zəvaid" 6/323, əl-Albani "Muxtəsər Uluv" s. 102, "Şərh Əqidətul Təhaviyyə" s. 279, 299, ***Mərfu*** **–** Peyğəmbər sözü olaraq edilən rəvayət zəifdir. Bax: "Silsilə Daif" 906. ***Həmçinin*** **–** Əbu Musa əl-Əşari yolu ilə "Movquf" olaraq rəvayət edilmişdir. Əhməd "Sünnə" 588,1022, Təbəri 5790, İbn Əbi Şeybə "Kitabul Ərş" 60, Beyhəqi "Əsmə" s. 404, 2/148, əl-Albani "Muxtəsər Uluv" 124, "Silsilə Daif" 2/306,307.

[331] əl-Albani – *rahmətullahi aleyhi* – Kursinin elm olduğuna dair İbn Abbas – *radıyallahu anhu* – dan edilən rəvayət haqqında deyir ki: "Bu rəvayətin İbn Abbas – *radıyallahu anhu* – ya isnadı səhih deyildir". "Silsilə Səhih" 1/226. ***Həmçinin*** **–** Kursinin Ərş olduğu barədə Həsənul Bəsri – *rahmətullahi aleyhi* – dən rəvayət edilən soz də İbn Kəsir – *rahmətullahi aleyhi* – nin söylədiyi kimi zəif olub Ondan səhih olaraq gəlməmişdir. İbn Cərir 5796, İbn Kəsir 1/318, "Təhzibut Təhzib" 2/113, Qurtubi "Cəmiul Əhkəmul Quran" 3/180-181, əl-Albani – *rahmətullahi aleyhi* – deyir ki: "Kursinin öz mənasından başqa digər bütün mənaları (elm olması, Ərş olması) rəvayətləri zəifdir". "Səhih Silsilə" 1/226. «Fəthu Rabbil Bəriyyə bi Təlhisil Həməviyyə» Ərş və Kursi bölümü. Useymin – *rahmətullahi aleyhi* – nin şərhi ilə.

[332] Əhməd 5/178,179, Bəzzar 160, Nəsəi 9/180, İbn Əbi Şeybə "Kitabul Ərş" 58, İbn Hibban "İhsan" 361, Zəhəbi "Uluv" 105, Beyhəqi "Əsmə" 2/149, əl-Albani "Səhih" 109, 1/226, "Muxtəsər Uluv" s. 130, "Şərh Əqidətul Təhaviyyə" s. 280,300.

[333] İbn Cərir ət-Təbəri.

yaratdıqlarını aciz buraxmışdır"[334]. Sələflər deyirlər: «Biz Allahın ehtiyac olmadan Ərş üzərinə İstiva və istiqrar etdiyini iqrar edirik. O, ehtiyac olmadan Ərşi də başqalarını da mühafizə edər» .

## ALLAH - *Subhənəhu Və Təalə* - nin ULUV – UCALIQ SİFƏTİ VƏ SƏMADA OLMASI

Ərşin üzərində olmasına baxmayaraq, bütün yaratdıqları üzərində uca, onlardan ayrı olmasına baxmayaraq, onları görən, onların nə halda olduqlarını bilən, hər şeyi elmi ilə əhatə edən də odur. Heç bir şey ondan gizli qalmaz, kimsə onunla çəkişməz, ona qarşı çıxmaz, ona heç bir şeydə əngəl olmaz. Əksinə hər şey onun əzəməti önündə boyun əyər, izzəti qarşısında zəlildir. Hər şey onun hökmü, idarəsi altındadır. O, şanı etibarı ilə ən yüksəkdir. O, bütün kamil sifətlərin sahibidir, bütün əskikliklər ondan uzaqdır. ***Əzizdir***, ***Cəlildir***, şanı mübarək və çox ucadır.

***Uluv*** – Ucalıq deməkdir. Allahın zatı sifətlərindən olub iki qismə ayrılır:

**1.** ***Sifətlərin Uluvvu*** **–** Bu var olan hər kamil sifətin hər baxımdan ən ucasının və ən mükəmməlinin sadəcə Allaha aid olması deməkdir. İstər bu sifət ***Məcd*** (şərəf) və ***Kahr*** (kahr etmə) sifətlərindən, istərsə ***Cəmal*** (gözəllik) və ***Qadr*** (şan, şərəf, hörmət) sifətlərindən olsun heç fərq etməz.

**2.** ***Zatın Uluvvu*** **–** Bu isə Uca Allahın zatıyla bütün yaratdıqlarının üstündə olması deməkdir. Sələflər deyirlər ki: «Hər kim Allahın (zatıyla) göydə olduğunu inkar edərsə heç şübhəsiz ki, kafir olmuşdur» .

Allahdan bir şey istədikdə yuxarıdan istənilir, aşağıdan deyil. Çünki aşağı heç bir şeydə Rububiyyət və Uluhiyyət sifətlərindən deyildir. Həmçinin yüksəklik alçaqlığın ziddidir. Alçaqlıq da əskiklik sifətindəndir. Zatıyla yüksəkdə olan Allah isə bütün əskik sifətlərdən münəzzəhdir. Allahın zatıyla yüksəkdə, yuxarıda olduğunu göstərən üç İsmi vardır. Bunlar ***əl-Aliyy*** , ***əl-Ələ*** və ***əl-Mutəalidir*** . Bunların üçü də Qurani Kərimdə zikr edilmişdir. Allah daima uca və böyükdür. Allahın uca və böyük olmasını isə: **1.** Qurani Kərim. **2.** Sünnə. **3.** Səhabələrin icması. **4.** Ağıl. **5.** Fitrət sübut edir.

Allahın səmada olmasına Quran və Sünnədə **18**-cür isbat vardır:

**1.** ***Min*** – dan, dən, ön qoşması ilə Allahın yüksəkdə olması - Fövq. ***«Onlar, onların fövqündə olan Rəblərindən qorxarlar».*** *(ən-Nəhl 50).*

**2.** ***Min*** – dan, dən, ön qoşması gəlmədən. ***«O, öz qulları üzərində hakim-mütləqdir».*** *(əl-Ənam 18 və 61).*

**3.** Ona doğru yüksəliş. ***«Mələklər və ruh onun dərgahına müddəti əlli min il olan bir gündə qalxarlar».*** *(əl-Məaric 4).* Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurur: «Onların arasında gecələyən mələklər yuxarıya qalxarlar (uruc edərlər). Allah onlardan soruşar….» .

**4.** ***Saədə*** – ***Suud*** – qalxmaq sözündən. ***«Pak söz ona tərəf yüksələr».*** *(Fatir 10).* Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və*

---

[334] əl-Albani "Şərh Əqidətul Təhaviyyə" s. 277,280.
[335] «Əqidətul Vasitiyyə» s. 73.
[336] Zəhəbi «Müxtəsər əl-Uluvv» s. 137.
[337] Bax: əl-Bəqərə 255, ən-Nisa 34, əl-Həcc 62, Loğman 30, Səba 23, əl-Mumin 12, əş-Şura 51.
[338] Bax: ən-Nəziət 24, əl-Ələ 1, əl-Leyl 20.
[339] Bax: ər-Rəd 9.
[340] Buxari 555,3223,7429,7486, Müslim 632, Məlik 1/155, H. 82, əl-Albani "Səhih" 8019, "Mişkət" 626.

*səlləm* - buyurur: «Allaha gözəl olandan (halaldan) başqa bir şey yüksəlmə » . Əbu Musa əl-Əşari - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah yatmır. Ona yatmaq yaraşmaz. Mizanı (Başqa rəvayətdə: Ədaləti) endirsin və ya qaldırsın. Gündüzün əməlindən əvvəl gecənin əməli, gecənin əməlindən əvvəl gündüzün əməli ona (Allaha) yüksəlir (qaldırılır) Onun örtüyü (pərdəsi, hicabı) nurdur. (Əbu Bəkr - *radıyallahu anhu* – nun rəvayətində pərdəsi atəşdir). Əgər üzündəki pərdəni qaldırsa üzünün nurları yaratdığı hər bir şeyi yandırar» .

**5.** ***Rafaə*** – ***Yarfəu*** – qalxmaq sözündən. Bir çox məxluqatı özünə doğru yüksəldən. ***«Ya İsa! Həqiqətən mən sənin ömrünü tamam edib öz dərgahıma qaldıraram».*** *(Ali İmran 55).* ***«Xeyir! Allah onu öz dərgahına qaldırmışdı».*** *(ən-Nisa 158).*

**6.** Mütləq ***Uluv*** (ucalıq) həm zatı, həm də sifətləri ilə. ***«O, Alidir*** *(ucadır)* ***və Azimdir*** *(böyük)****».*** *(əl-Bəqərə 255).* ***«Allah hər şeydən uca və böyükdür».*** *(əl-Həcc 62).*

**7.** Kitabın onun tərəfindən endirilməsi. Nazil olması. ***«O, yeri və uca göyləri yaradan Allah tərəfindən endirilmişdi».*** *(Ta ha 4).* ***«De ki, onu Ruhul-Qüds*** *(Cəbrail)* ***Rəbbindən haqq olaraq endirmişdi».*** *(ən-Nəhl 102).* ***«Həqiqətən biz Quranı dünya səmasına nazil etdik».*** *(Qədir 1).*

**8.** Bəzi məxluqların ona yaxın olması. ***«Rəbbinin yanında olanlar».*** *(əl-Əraf 206).* ***«Göylərdə və yerdə nə varsa onundur. Onun yanında olanlar isə…»*** *(əl-Ənbiya 19).* Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurur: «O, kitab onun yanında Ərşin üstündədir» . ***«Fironun yoldaşı*** *(Asya dua edərək)* ***Ey Rəbbim! Öz dərgahında mənim üçün ev qərar et və məni Firon və onun əməlindən qurtar. Məni zalım qövmdən xilas et».*** *(Təhrim 11).*

**9.** ***Fi*** – da, də, ön qoşması ilə Allahın göydə olması. ***«Göydə olanın yeri titrədib sizi onun dibinə göndərməyəcəyinə əminsinizmi. Göydə olanın sizin üstünüzə daş yağdıran bir yel göndərməyəcəyinə arxayınsınızmı?»*** *(Mulk 16,17).* İbn Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Rəhman olan Allah Rəhm edənlərə Rəhm edər. Yerdə olanlara rəhm edin ki, səmada olan da sizə rəhm etsin» . Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Siz mənə iman gətirmirsiniz (Etibar etmirsiniz). Mən səmada olanın əminiyəm (Səmada olan mənə etibar etdiyi halda). Səhər-axşam mənə səmalardan xəbərlər gəlir» .

Allahın göydə olması bu iki mənadan birini kəsb edir[346].

---

[341] Buxari 1410,6993,7340, Müslim 1014, İmam Əhməd 3/33,418, əl-Albani «Muxtasarul Uluvv» s. 86, 11, "İrva2 886, "Mişkət" 1/431, "Səhih" 5600,6152.

[342] Müslim 179/293, İmam Əhməd 4/395,401, İbn Məcə 195, Darimi «ər-Rədd aləl Mərisi» s. 173, Beyhəqi «Əsmə və Sifət» s. 402, əl-Albani «Muhtasarul Uluvv» s. 86, «Səhih Cəmius Səğir» 1860.

[343] Buxari, Müslim.

[344] Buxari, Müslim.

[345] Buxari 3344,3610,4351,5058,6931,7562, Müslim 1063, Huzeymə 2373, Əbu Davud 4764, əl-Albani "Muxtəsər Uluv" s.84, "Səhih" 2645, "İrva" 864.

[346] ***Yön (Tərəf, İstiqamət, Məkan)*** Bu bölümdə Allah üçün yön olub-olmadığı barədə danışacağıq. Allah üçün yön (məkan) təyin etmək doğru deyildir. Əgər yön (məkan) deməklə alçaqlıq (aşağı) qəsd edilmişsə bu Allah üçün qəbul edilməzdir. Çünki Allah zatıyla, sifətlərilə Ucadır. Əgər yön (məkan) deməklə yüksəklik tərəf qəsd edilmişsə, bu da Allah üçün qəbul edilməzdir. Çünki Allahı yaratdıqlarından heç bir şey əhatə edə bilməyəcək qədər Böyük və Ucadır. Kursisi göyləri və yerləri əhatə etmişkən yaratdıqları Onu necə əhatə edəbilər? Əgər yön (məkan) ilə Allahı əhatə etmək olmadan Onun Böyüklüyünə və Ucalığına yaraşır yüksəkli yönü qəsd edilmişsə, bu Allah üçün var olan həqiqətdir. Əgər səndən: Siz Allahın yaratdıqlarından bir şeyin Onu əhatə etmiş ola biləcəyini rədd edisiniz. Allahı Kitabında və Peyğəmbərin Sünnəsində: Allahın göydə olması – sözünə nə deyirsiniz?". Cavab: Allahın göydə olması göyün Onu əhatə etməsini bildirməz. Allahın göydə olmasını – göyün Onu əhatə etdiyini söyləyən kimsə sapıq, əgər başqasına nisbət edərək söyləmişsə yalançı və xətalıdır. Allahın böyüklüyünü, Onun hər şeyi (Elmilə) əhatə etdiyini, Qiyamət

1) Burada göy ilə yüksəklik qəsd edilmişdir. Buna görə də məna: «Allah yüksəkdədir, yəni yüksəklik yönündədir». Göy, Qurani Kərimdə sabit olan yüksəklik mənasındadır. Məs: ***«Göydən üstünüzə yağış yağdırmışdır».*** *(əl-Ənfal 11)* . Yəni göyün özündən deyil, yüksəkdən su (yağış) endirir. Çünki yağış buluddan enər (yağar).

2) Ayədə keçən «***Fi – Səməi***» ləfsindəki ***«Fi»*** ***«Alə»*** mənasındadır ki, bundan da «Allah göyün üstündədir» olur. Qurani Kərimdə bir çox yerlərdə ***«Fi»*** (da, də içində), ***«Alə»*** (üstə, üzərində) mənasına gəlməkdədir. Məs: ***«Yer üzündə dolaşın».*** *(ət-Tövbə 2).* Yəni yerin üzərində dolaşın, içində deyil. *(Firon dedi)* ***Mən də sizin əl-ayağınızı çarpaz kəsdirib xurma ağaclarının kötüklərindən asacağam».*** *(Ta ha 71).* Yəni xurma ağacının üzərinə asacağam, içinə deyil.

**10.** ***İstiva*** – ucalması. ***«Rahmən ərşin üzərinə yüksəldi».*** *(Ta ha 5).* ***«O, böyük əzəmətli Ərşin sahibi».*** *(əl-Muminun 86).*

**11.** Dua edərkən əllərin qaldırılması. Salman Farisi – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Həya və Kərəm sahibi olan Rəbbimiz əllərini ona tərəf qaldıran qulunun əllərini geri boş qaytarmaqdan utanır» . Əbu Hənifə – *rahmətullahi aleyhi* – deyir ki: «Uca Allaha əllər yuxarıya qaldırılaraq dua edilir. Aşağıdan dua edilməz. Aşağıda olmanın Rububiyyətdən və Uluhiyyətdən heç bir əlaqəsi yoxdur» .

**12.** Allahın dünya səmasına enməsi. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Rəbbimiz hər gecənin **1/3-**də dünya səmasına enir və buyurur: Mənə dua edənin duasını qəbul edərəm, məndən istəyənin istədiyini verərəm, bağışlanma diləyəni bağışlayaram» .

**13.** Rəsulullah – *sallallahu aleyhi və səlləm* - in vida həcci. Cabir b. Abdullah – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsululah – *sallallahu aleyhi və səlləm* - vida həcci zamanı xütbəsində buyurdu: «Mən sizə dində olan hər bir şeyi çatdırdımmı?» Səhabələr: «Bəli, ya Rəsulullah!» Allah Rəsulu şəhadət barmağını qaldıraraq: «Ya Rəbbim! Sən şahid ol ki, mən onlara hər bir şeyi çatdırdım» .

**14**. ***Əynə*** – harada? Sözünün işlədilməsi. Müaviyə b. əl-Həkəm əs-Sələmi – *radıyallahu anhu* – rəvayət edir ki, bir cariyəm var idi. Çöldə qoyun otarırdı. Bir gün canavar qoyunlardan birini yediyinə görə çox qəzəbləndim. Hətta cariyəyə sillə də vurdum. Peşmançılıq çəkdim və hadisəni Rəsulullah – *sallallahu aleyhi və səlləm* - ə danışdım. Allah Rəsulu buyurdu: «Cariyəni yanıma çağır». Cariyə gəldikdə, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Sən möminəsən?» O, da bəli

---

günü yer üzünün Onun ovcunda olacağını, göyü kitab səhifəsi kimi bükəcəyini bilən bir kimsə əsla yaratdıqlarından hər hansı bir şeyin Onu əhatə etdiyini ağlına belə gətirməz"[346]. ***Cism*** - Allahın Cism olması mümkün deyidir. Cism haqqında danışmaq və Allahın cism olub-olmadığını söyləmək Kitab, Sünnət və Sələfin sözlərində keçməyən bidətdir. Cism iki və daha çox maddədən əmələ gələn bir şeydir, kütlə. Əgər cisimdən hər bir parçası digərinə möhtac olan bir neçə parçalardan yaranan, sonradan var olmuş bir şey qəsd edilirsə bu ***Həyy*** və ***Qayyum*** olan Allah haqqında mümkün deyidir[346].

[347] Bax: əl-Bəqərə 22, İbrahim 32, ər-Rəd 17, əl-Hicr 22, Ta ha 53, əl-Həcc 5, 63.

[348] Əbu Davud 1488, Tirmizi 3551, İbn Məcə 3865. Musnəd 5/438, əl-Albani "Səhih".

[349] Fikhul Əbsat s. 51.

[350] Buxari 1145, Müslim 168, 758, Əbu Davud 1315,4733, Tirmizi 446,3498, İbn Məcə 1366, Darimi 1478, Əhməd "Sünnə" 153, Lələkai 745, Zəhəbi "Uluv" 78, əl-Albani "Ziləlul Cənnə" 492-503, "İrva" 450, "Səhih" 8165, Mişkət "1223.

[351] Müslim 1218, Əbu Davud 1905, İbn Məcə 3074, Darimi 1850, Zəhəbi "Muhtəsər Uluv" 2, əl-Albani "Uluv" 83, "İrva" 4/210-209, 1017, "Mişkət" 2/783-787, 2555.

dedikdə Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «***Əynəallah*** – Allah haradadır?» .

**15.** Allahın səmada olmasını söyləyənin iman sahibi olması. Muaviyə b. əl-Həkəm əs-Sələmi – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - cariyədən soruşdu: «***Əynəallah*** – Allah haradadır?» Səma üzərində. Bəs mən kiməm? «Sən Allahın Rəsulu» . Bəlkə də bizlərin Allah haradadır deyə sual verməyimizə gülə bilərlər. Lakin yaradılmışların ən mükəmməli, Rəbbimizi ən gözəl tanıyan Allah haqqında haradadır deyə sual verdiyini unutmuşlar? O, da cariyənin gözəl cavabını qəbul etmişdir.

**16.** Fironun Allahın səmada olmasını yalanlaması. ***Firon dedi: «Ey Haman! Mənim üçün bir qəsr tik ki, bəlkə göylərin yollarına yetişim və Musanın Rəbbini görüm. Doğrusu mən onu yalançı sayıram».*** *(əl-Mumin 36-37).* Yəni Firon, Musa – *əleyhissəlam* - ın İlahının səmada olmasına dair vermiş olduğu xəbərin yalan olduğunu sayırdı. Buna görə də Firon öz qövmünə bunu sübut etmək üçün Hamana onun üçün Qəsr tikməsini əmr edir və sonra: ***«Doğrusu mən onu yalançı sayıram».*** *(əl-Mumin 36-37).* O, halda belə bir sual ortaya çıxır: «Nisbət etibarı ilə kim Firona daha yaxın olur? Allahın səmada olmasını qəbul edən bizlər? Yoxsa???» Heç şübhəsiz ki, Firon, Musa – *əleyhissəlam* – ın İlahının səmada olmasını yalan saymışdı. Allahın ucalığını və səmada olmasını qəbul etməyənlər Firon, səmada olmasını qəbul edənlər isə Musa və Muhəmməd – *sallallahu aleyhi və səlləm* – in yolundadırlar.

**17.** Rəsulullah – *sallallahu aleyhi və səlləm* - in merac səfəri. Onun orada Peyğəmbərlərlə görüşməsi, Allahın dərgahında namazın fərz olması və s . Zeynəb – *radıyallahu anhə* – möminlərin anası, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - in zövcəsi – o biri qadınların yanında daima fəxr ilə deyərdi: «Sizi atalarınız ərə verib, məni isə Allah yeddi qat səma üzərində evləndirib» .

**18.** Qiyamət günü Cənnət əhlinin öz Rəblərini görmələri. ***«O, gün neçə-neçə üz öz Rəbbinin camalına baxıb sevinəcəkdir».*** *(əl-Qiyamət 22-23).*

Mən deyirəm ki, Allah Qurani Kərimdə bir çox ayələrin sonlarında buyurur ki, bu ayələrdə ağıl sahibləri, hikmətli insanlar üçün ibrətlər vardır. Ağlı olmayan insan yalnız bu qədər dəlilləri inkar edib Allahın göydə olmasını qəbul etməyə bilər. Səhabələrin, Tabiinlərin, Sələfi Salihin alimlərinin və bütün haqq yolda olan müsəlmanların da qəbul etdiyi, Allahın səmada olmasıdır. Əbu Muti deyir ki, Əbu Hənifə – *rahmətullahi aleyhi* - dən: "Mən Rəbbimin səmada, yoxsa yerdə olduğunu bilmirəm deyən kimsə barəsində soruşdum". O, dedi: «Bu kimsə kafir olur». Çünkü Allah buyurur: ***«Rahmən ərşin üstünə yüksəldi».*** *(Ta ha 5).* Onun Ərşi isə yeddi səmanın üstündədir. Mən: «Əgər o, Ərşin üzərindədir dediyi halda, bilmirəm Ərş səmadadır, yoxsa yerdədir" desə? O, dedi: «Yenə o, kafirdir. O, Allahın səmada olmağını inkar edir»[356].

Ağıl və Fitrət ilə isbata gəlincə, bütün insanlar təbiətləri və səlim qəlbləri ilə dua etdikləri zaman əllərini yuxarı qaldırırlar. Uca Allaha yalvarıb-yaxardıqda da qəlbləri

---

[352] Müslim 537, «əl-Fiqhul Əbsat» s. 47,48.
[353] Müslim 537.
[354] Buxari, Müslim.
[355] Buxari 6984, Beyhəqi "Əsməu Və Sifət" səh: 315,316, №880, Suyuti "Durul Mənsur" 6/611,612, "Xasaisul Kubra" 2/368, İbn Qudamə "İsbat Uluv" səh 109, İbn Kəsir "Təfsirul Quran" 6/407, "Səhih Sünən Tirmizi" 3213.
[356] Əbu İsmail əl-Ənsari əl-Faruk əsəri "Fikhul Əbsat" səh: 46, İbn Teymiyyə "Məcmuul Fətava" 5/48, Zəhəbi "Uluv" səh: 101,102, İbn Qudamə "Uluv" səh: 116.

ilə yuxarını qəsd edərlər. Bu Allahın onları yaratmamışdan əvvəl qəlblərində fitrət olaraq yerləşdirdiyi hislərdir. Onlar bunu bir insandan, müəllimdən öyrənməmişlər. Bu sadəcə qəlbdə olan Allahın ucalığını göstərən hislərdir.

## MÜXALİFLƏRİN GƏTİRDİKLƏRİ BƏZİ ŞÜBHƏLƏR VƏ ONLARA VERİLƏN CAVABLAR

***Müxaliflərin Şübhələri:*** Müxaliflər müsəlmanların qəlblərinə şübhə salmaq üçün bəzi ayələri dəlil gətirirlər. ***«Göydə olanın».*** *(Mulk 16-17).* Zahirini qəbul etsək, səmanın Allahı kölgələdiyini, Onu daşıdığını, Onu əhatə etdiyini desək düzgün olmaz. Bu sözləri söyləyən kimsə əgər bunu özündən demişsə sapıq, yox əgər başqasına nisbət edərək söyləmişsə o, təqdirdə yalançı və xətalı olmuşdur. Allahın böyüklüyünü: ***«Ən Uca və ən böyük varlıq da Odur!».*** *(əl-Bəqərə 255).* ***«O,*** *(hər şeydən)* ***Ucadır,*** *(hər şeydən)* ***Uludur!».*** *(əş-Şura 4).* Onun hər şeyi elmi ilə əhatə etdiyini (***MUHİT***) : ***«Halbuki Allah kafirlərin bütün işlərini biləndir».*** *(əl-Bəqərə 19).* ***«Allahın hər şeyi öz elmi ilə ehtiva etdiyini biləsiniz deyə…».*** *(ət-Talaq 12).* Qiyamət günü yer üzünün Onun ovcunda olacağını: ***«Halbuki Qiyamət günü yer bütünlüklə onun ovcunun içində olacaq, göylər isə onun sağ əli ilə büküləcəkdir».*** *(əz-Zumər 67).* Göyü də kitab səhifəsi kimi bükəcəyini: ***«Göyü kitab səhifəsi kimi büküb qatlaycağımız gün*** *(Qiyamət gününü)* ***yadınıza salın».*** *(əl-Ənbiya 104). Göyün də Allaha ehtiyacı olduğunu:* ***«Onun izni olmadan yerə düşə bilməməsi üçün göyü tutub saxladığını görmürsənmi».*** *(əl-Həcc 65).* Bilən bir kimsə əsla yaratdıqlarından hər hansı bir şeyin Allahı kölgələdiyini, daşıdığını, əhatə etdiyini belə ağlına gətirməz.

***Müxaliflərin Digər Şübhələri***: ***«And olsun ki, insanı biz yaratdıq və nəfsinin ona nə vəsvəsə etdiyini də biz bilirik. Biz ona şah damarından da yaxınıq».*** *(Qaf 16).* Bəli, bu ayəni oxuduqda biz fikirləşə biləik ki, Allah bizə şah damarımızdan da yaxındır. Lakin nə ilə yaxın olduğunu biz sonrakı ayədən başa düşürük. ***«Xatırla ki, sağında və solunda yazan iki mələk oturmuşdur».*** *(Qaf 17).* O, mələklər ki, insanın ağzından çıxan hər bir kəlməni qeyd edirlər.

***Müxaliflərin Digər Şübhələri***: ***«Göylərdə də, yerlərdə də yalnız o Allahdır. Sizin gizlində də, aşkarda da nəyiniz varsa onu, tutduğunuz əməlləri O bilir».*** *(əl-Ənam 3).* Bu ayə Allahın zatıyla göydə olduğu kimi, yerdə də olduğu mənasına gəlməz. Bu cür fikirləşən çox böyük xəta etmişdir. Qurani Kərimdə olan digər bir ayə bunu çox gözəl açıqlayır. ***«Göydə də ilah*** *(ibadət olunan)* ***yerdə də ilah Odur. O, hikmət sahibidir, biləndir».*** *(Əz-Zuxruf 84)*[358]. Şübhəsiz ki, Allah göylərdə də, yerlərdə də ibadət olunan ilahdır. Göydə də, yerdə də olan hər bir şey ilah olaraq yalnız Allaha ibadət və itaət edirlər. Çünki Allahın göylərin üzərində olması sizin gizlində də, aşkarda da etdiyinizi bilməsinə əngəl törətməz. Hər nə qədər Allah zatıyla göydədisə ilahlığı (tanrılığı) isə hər iksindədir. Bunun bir bənzəri də: «Filankəs Məkkədə də əmirdir, Mədinədə də». Yəni o, kimsə hər nə qədər bu şəhərlərdən birində olursa olsun əmirliyi hər iki şəhərdə də keçərlidir. İmam Məlik – *rahmətullahi aleyhi* – deyir ki: «Allah göydədir, elmi isə hər yerdədir» .

---

[357] Bu İsim üçün bax: Ali İmran 120, ən-Nisa 108, 126, əl-Ənfal 47, Hud 92, Fussilət 54, əl-Buruc 20.

[358] Təfsir İbni Kəsir.

[359] Əbu Davud «Məsailu İmam Əhməd» s. 263, İbn Əbdul Bərr «Təmhid» 7/138.

***Müxaliflərin Digər Şübhələri***: ***«Can boğaza yetişdiyi zaman, siz ona baxıb durursunuz. Biz ona sizdən daha yaxınıq, amma siz görmürsünüz».*** *(əl-Vaqiə 83-85).* Allah: «*Biz Ona Sizdən Də Yaxınıq*» buyurduqda, ölüm anında ***Ölüm*** – mələyinin ölən insana yaxın olduğunu buyurur. Bəs nə üçün Allah birinci şəxsin adından danışır? Mələklər Allahın elçiləridir və onladan danışıldıqda birinci şəxsisn adından danışılır. ***"Biz onu*** *(Cəbrailin dili ilə)* ***oxutduğumuz zaman oxunmasını diqqətlə dinlə".*** *(əl-Qiyamət 18).* ***"İbrahimin qorxusu çəkildikdə və ona*** *(İshaqın doğulacağı haqqında)* ***müjdə gəldikdə Lut tayfası barəsində Bizimlə*** *(mələklərimizlə)* ***mübahisə etməyə başladı.*** *(Əzabın onlardan dəf edilməsini istədi)****".*** *(Hud 74).* Hər iki ayədə söhbət mələklərdən gedir. ***Həmçinin*** **-** Bu ayədə ölüm anı xüsusiləşdirilmişdi. Əgər biz desək ki, Allah bizə yalnız ölüm anında yaxındır, bu düz olmaz, çünkü Allah bizə hər an yaxındır. Ölüm anının xüsusiləşdirilməsi isə o, anda ölüm mələyinin yaxın olmasına görədir. Allahın bizə hər an yaxın olması isə Quran və Sünnə ilə sabitdir. Bu da duadır. ***«Bəndələrim məni səndən soruşsalar söylə ki, mən onlara yaxınam. Dua edib məni çağıranın duasını qəbul edərəm».*** *(əl-Bəqərə 186).* Burada söhbət Allahdan nə isə istəmək və Allaha ibadət etmək üçün olunan duadan gedir.

***Qayda:*** İstək duası zamanı insan bir şeyə diqqət etməlidir! Allahın adlarından öz istədiyi şeyə münasib olanını istədiyindən qabaq çəkməlidir. Məs: «Ey Rahmən olan Allah! Mənə rəhm et, məni bağışla!» «Ey qoruyan, məni qoru!» və s. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurur: «Sizin dua etdiyiniz Allah sizdən hər hansı birinizin dəvəsinin boynundan da ona yaxındır»[360]. Allahın yaxın olması ucalığına və yuxarıda olmasına zidd deyildir. Çünkü bütün sifətlərində Allaha bənzər bir şey yoxdur. O, yaxın olması ilə də ucadır, ucalığı ilə də yaxındır. ***«Allah*** *(müşriklərin)* ***ona aid etdikləri sifətlərdən tamamilə uzaqdır».*** *(əs-Saffət 159).* Həsənul Bəsri – *rahmətullahi aleyhi* – deyir ki: "***Allahummə*** **-** kəliməsi özündə istənilən növ istəyi əhatə edir". Əbu Radca əl-Ataridi – *rahmətullahi aleyhi* – deyir ki: "***Allahummə*** **-** kəliməsində olam "***Mim***" hərifi özündə Allahın **99** İsmini əhatə edir". ən-Nadr b. Şamil – *rahmətullahi aleyhi* – deyir ki: "Kim ***Allahummə*** **-** deyərək Allaha dua etməyə başlayarsa artıq Allahı bütün İsimləriylə çağırmış olar".

***Müxaliflərin Digər Şübhələri***: ***«Məgər görmürsənmi ki, Allah göydə və yerdə nə varsa, hamısını bilir. Aralarında gizli söhbət edən üç adamın dördüncüsü, beş adamın altıncısı Allahdır. Onlar bundan az da, çox da olsalar və harda olsalar, Allah yenə də onların yanındadır. Sonra Qiyamət günü Allah onlara etdikləri əməlləri*** *(bir-bir)* ***xəbər verəcəkdir. Allah hər şeyi biləndir».*** *(əl-Mucadələ 7).* ***«Siz harda olsanız, o, sizinlədir. Allah sizin nə etdiklərinizi görəndir».*** *(əl-Hədid 4).* İlk baxışdan bu ayələr insana şübhə gətirə bilər. O, sizinlə bərabərdir buyuruğu: Allah yaradılmışlar ilə qarışmış, onların yanlarındadır demək deyil. Xeyr! Allah Ərşin üzərindədir, məxluqatın üzərində ***Raqibdir*** (nəzarət edəndir). Əgər ayələrin sonlarına fikir versəniz görərsiniz ki, Allahın bizimlə bərabər olması, Onun bizim etdiklərimizi bilməsi və görməsi ilədir. Elm, qüdrəti ilə hər bir şeyi idarə edən, əhatə edən, himayə edən haqqında düşünmək ki, o məxluqlarla, naqislərlə, günahkarlarla birlikdədir. Bu ağla sığmazdır. Sufyan əs-Souri – *rahmətullahi aleyhi* – deyir ki: ***"...Allah yenə də onların yanındadır".*** Yəni: Elimi ilə onlarladır"[361]. Sələflər (Səhabə və Tabiinlər) bu

[360] Buxari, Müslim.
[361] Zəhəbi "Uluv" 139.

barәdә icma etmişlәr: "O, Әrşi üzәrindәdir, elimi isә hәr bir yerdәdir"[362]. İbn Kәsir – *rahmәtullahi aleyhi* – bu ayәnin tәfsirindә deyir ki: "Mәhz bu sәbәbә görә bir çox insanlar deyirlәr ki, İcma vardır "*Yanında*" kәlimәsinә görә. Yәni, burada qәsd olunan "Yanındadır Elimilә" demәkdir[363].

Әhli Sünnә Vәl Cәmaat alimlәri Allahın yaratdıqları ilә bәrabәr olmasını, Zatı ilә deyil mәhz elmi ilә onlarla bәrabәr olması şәkilindә açıqlamışlar. Burada mәqsәd sapıq Hüluliyyәçilәrә cavab vermәkdir . Pak vә nöqsansız olan Allahın yaratdıqlarıyla bәrabәr olması Ona yaraşır bir bәrabәrlik olub әsla yaradılmışların bir-birlәriylә olan bәrabәrliyi kimi deyildir. Heç şübhәsiz ki, onların dәlillәri Allahın hәm zatıyla yaratdıqlarının üstündә, hәm dә onlarla bәrabәr olduğunu ifadә etmәkdәdir. Bunların hәr iksinin dә sübut vә dәlili güclüdür. Allahın bu buyurduğunda hәr iksinә dә dәlil vardır. ***«Göylәri vә yerlәri altı gündә xәlq edәn, sonra әrşin üzәrinә yüksәlәn** (istiva edәn)* ***Odur. O, yerә girәni dә, yerdәn çıxanı da, göydәn enәni dә, göyә qalxanı da bilir. Siz harda olsanız O, sizinlәdir. Allah sizin nә etdiklәrinizi görәndir!».*** *(әl-Hәdid 4).* Bu ayәdә Allah yaradılmışların (mәxluqatın) әn üstündә, әn yüksәkdә olan Әrşә İstiva etdiyini bildirdiyi kimi, bizimlә bәrabәr olduğunu da bildirmişdir. Yüksәkliklә bәrabәrlik arasında bir ziddiyyәt yoxdur. Bir şey hәm zatı ilә yüksәkdә dә ola bilәr, hәm dә ona bәrabәrlik nisbәt edilә dә bilәr. Әgәr biz Allahın yaratdıqlarından olan Aya baxsaq görәrik ki, o sәmada yerlәşdirilmişdir. Bununla bәrabәr o, sәfәrdә olan hәr bir kәsә hara gedirsә getsin onunla birlikdәdir. Halbuki Ay göydәdir vә bizimlә bәrabәr hәrәkәt etmәkdәdir. Ayın bәrabәr olması onun işıq saçması vә görülmәsinә görәdir. Ay isә Allahın ayәlәrindәn әn kiçiyidir. Bir qadın Allah haradadır? deyә soruşuduqda İmam Әbu Hәnifә: «Allah sәmadadır, yerdә deyil» cavabını verdi. Bәs Allah: ***«Siz harda olsanız, o sizinlәdir».*** *(әl-Hәdid 4)* sözünә nә deyirsәn?» sualına isә belә cavab verdi. «Bu sәnin bir kimsәyә mәktub yazıb mәn sәninlә bәrabәrәm demәyin kimidir. Halbuki sәn onun yanında deyilsәn» .

***Müxaliflәrin Digәr Şübhәlәri***: Ubadә b. Samit – *radıyallahu anhu* – rәvayәt edir ki, Rәsulullah – *sallallahu aleyhi vә sәllәm* – buyurdu: «İmanın әn üstünü harada olursansa ol, Allahın sәninlә bәrabәr olduğunu bilmәkdir»[366]. Bu hәdis, bu lәfzlә hәdis alimlәri tәrәfindәn zәif qәbul edilmişdir. Әyyub Sәhtiyani – *rahmәtullahi aleyhi* – Mutәzilә vә Cәhmilәr barәdә deyir ki: "Onların (etiqadının) әsası: Sәma üzәrindә heç

---

[362] Zәhәbi "Uluv" 572.

[363] Fәxrәddin Razi "Mәfәtihal Qeyb" ayәnin tәfsiri.

[364] ***Hululiyyә –*** Allahın Zatıyla hәr yerdә olduğunu qeyd edәnlәrdir. Onlar Allahın ***Mәiyyә –*** Birlikdә, bәrabәr olmaq sifәtindә hәddi aşaraq Allahın ona yaxın olan (***әl-Mukәrrәbun***) şәxslәrә hulul etdiyini (yәni nüfuz etmәk, girmәk, iki şeyin bir şeymiş kimi birlәşmәsini) irәli sürәn sapıq firqәdir. Onlara görә kim nәfsini itaәtlә tәrbiyә edәr, dünya lәzzәtlәri vә şәhvәtlәrinә sәbr edәrsә Allaha yaxın olanların (***әl-Mukәrrәbun***) mәqamına yüksәlir. Sonra o, bәşәriyyәt sifәtlәrindәn tәmizlәnincәyә qәdәr, saflaşmaya vә saflaşmış olanların dәrәcәsinә yüksәlmәyә davam edәcәkdir. Saflaşma әsnasında bәşәriyyәtdәn bir parça da belә qalmadıqda İsa b. Mәryәmә hulul edәn Allahın ruhu ona da hulul edәr. O, zaman istәdiyi kimi olan şeydәn başqasını dilәmәz vә әmәllәrinin tamamı Allahın feli olur, sonunda da Allaha birlәşәrәk, Allah olur!? AbdulQahir әl-Bağdadiyyәnin bölümünә görә **11** qurupdur. Bunlar: ***Hululiyyә, Sәbәiyyә, Beyaniyyә, Cәnahiyyә, Hatabiyyә, Şurayiyyә, Nemiriyyә, Rizamiyyә, Mukannaiyyә, Hulmaniyyә, Hallaciyә vә Azafira.*** Hululiyyә eyni zamanda müşәbbihlәrin (bәnzәdәnlәrin) hәddi aşanlarıdır. Rafizilәr içәrsindә dә Allahın imamlara Hulul etdiyini deyәnlәr dә vardır. Bax: «Mәqalәtul İslamiyyә» 1/81,82, «Fәrq Beynәl Firaq» s. 198,205.

[365] Beyhәqi «әl-Әsma vә әs-Sifәt» 429, Zәhәbi «Uluvv» müxtәsәr: s. 135.

[366] Tәbәrani "Kәbir", "Әvsat", Huzeymә "Mәcmuuz Zәvaid" 25, Әbu Nuaym "Hilyәtul Әvliya" 6/124, Beyhәqi "Әsmә" 2/172, Suyuti "Cәmius Sağir" 1/49, әl-Albani "Daif Cәmius Sәğir" 1002, "Silsilә Daif" 2589. Lakin Abdullah İbn Muaviyә әl-Ğadiri – *radıyallahu anhu* – dan gәlәn rәvayәtdә: «Nәfsin tәmizlәnmәsi (yaxşılığı) harada olursansa olsun Allahın onunla bәrabәr olduğunu bilmәsidir» Beyhәqi «Sünnәn Kubra» 4/95, әl-Albani «Sәhih Hәdislәr Silsilәsi» 1046.

nə yoxdur – deməkdir”[367]. ***«O, Əvvəldir, Axırdır, Zahirdir, Batindir».*** *(əl-Hədid 3).* Muqatil b. Həyyan – *rahmətullahi aleyhi* – deyir ki: “Sən ***Əvvəlsən,*** səndən əvvəl heç bir şey yoxdur. Sən ***Əxirsan,*** səndən sonra heç bir şey yoxdur. Sən ***Zahirsən,*** Sən hər bir şeyin üzərindəsən (sənin üstündə heç bir şey yoxdur). Sən ***Batinsən,*** sən hər bir şeydən yaxınsan (Səndən o, tərəfə heç bir şey yoxdur). Yəni, gücü və elimi ilə hər bir şeyə yaxındır, Özü isə Ərşin üzərindədir və O, hər bir şeydən xəbərdardır”[368].

## ALLAH - *Subhənəhu Və Təalə* - nin MƏİYYƏ – BİRLİKDƏ, BƏRABƏR OLMAQ SİFƏTİ

***Məiyyə*** – birlikdə olmaq sifəti iki cürdür:

**1. *Ümumi*** – yəni Allah elmi ilə, qüdrəti ilə, tədbiri ilə (işləri düzüb qoşmaq və idarə etməsi ilə) hamı ilə bərabərdir. Zatı ilə yox. Heç bir şey ondan gizli deyildir. ***«Çünki mən sizinlə bərabərəm. Eşidirəm və görürəm».*** *(Ta ha 46).* ***«Bir də səbr edin. Allah səbr edənlərlə bərabərdir».*** *(əl-Ənfal 46).* ***«Həqiqətən Allah ondan qorxub pis əməllərdən çəkinənlər və yaxşı işlər görənlərlədir».*** *(ən-Nəhl 128).* Aişə – *radıyallahu anhə* - deyir: «Bir qadın ərindən şikayət etmək üçün Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in yanına gəlir. Mən otağın bir küncündə olmağıma baxmayaraq onların nə barədə söhbət etdiklərini eşitmədim. Lakin Allah eşidib ayə nazil etdi. ***«Əri barəsində səninlə mübahisə edən və Allaha şikayət edən qadının sözünü Allah eşitdi. Allah sizin danışığınızı eşidir. Həqiqətən Allah eşidən və görəndir».*** *(əl-Mucadələ 1)»* .

**2. *Xüsusi*** – yəni Allah elmi, qüdrəti ilə yalnız Peyğəmbərlərlə, möminlərlə, müsəlmanlarla birlikdədir. ***«Müşriklərin hamısı səninlə vuruşduğu kimi siz də onlarla vuruşun və bilin ki, Allah müttəqilərlədir».*** *(ət-Tövbə 36).* ***«Allah həqiqətən möminlərlədir».*** *(əl-Ənfal 19).* Rəsulullah – *sallallahu aleyhi və səlləm* – Əbu Bəkr - *radıyallahu anhu* - ilə mağarada olarkən Əbu Bəkr - *radıyallahu anhu* - müşrikləri gördükdə qorxaraq: «Allaha and olsun ey Allahın Rəsulu, onlardan biri ayağının altına baxsa bizi mütləq görəcəkdir. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – ona Allahın buyurduğu şəkildə: ***«Qəm yemə, Allah bizimlədir».*** *(ət-Tövbə 40).* «Üçüncüləri Allah olan iki kişi barəsində sən nə düşünürsən» . O, halda buradakı bərabərlik yardım və düşmənlərdən qorumaq mənasındadır. ***Həmçinin*** – Allah Musa və Harun - *əleyhissəlam* – a müraciət edərək: ***“****(Allah)* ***buyurdu: “Qorxmayın, Mən də sizinləyəm,*** *(hər şeyi)* ***eşidirəm və görürəm!”.*** *(Ta ha 46).* ***Həmçinin*** - Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah zatıyla yüksəkdə olmasına baxmayaraq namaz qılanın qarşısındadır. Onun üzünə baxar» . Yüksəkliklə, qarşıda olmaq arasında bir ayrılıq yoxdur. Bir şey həm yüksəkdə həm də qarşıda ola bilər. Çünki qarşıda olmaq yerdə olmaq demək deyil. Məs: Doğan günəşə baxan kişi, onun yəni günəşin qarşısında olduğunu söyləyir. Lakin günəş göydədir. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: “Allahın məxluqatı ilə bərabər olması ayələrdən aslı olaraq dəyişilir. ***«Göyləri və yerləri altı gündə xəlq edən, sonra ərşin üzərinə yüksələn*** *(istiva edən)* ***Odur. O, yerə girəni də, yerdən çıxanı da, göydən enəni də, göyə qalxanı da bilir. Siz***

---

[367] Zəhəbi “Muxtəsər Uluv” 132, Əhməd “Musnəd” 6/457, 27627, İbn Batta “İbanə” 3/194.
[368] Beyhəqi “Əsmə” 2/173.
[369] Buxari.
[370] «əl-Lulu Vəl Mərcan» 1540, Buxari, Müslim, Əhməd 1, Tirmizi 3096.
[371] Buxari 406,753,1213,6111, Müslim 547, Məlik 1/173, Əhməd 2/6,29, Nəsai 2/51, İbn Məcə 731, Beyhəqi «Əsmə və Sifət» s. 465. əl-Albani «Səhihul Tərğib» 1/186,188, «Səhihul Cəmius Səğir» 753.

***harda olsanız O, sizinlədir. Allah sizin nə etdiklərinizi görəndir!».*** *(əl-Hədid 4).* Ayədən açıq-aydın görsənir ki, Allahın məxluqatı ilə bərabər olması Allahın insanları görməsi, onlardan xəbərdar olmasıdır. (Elmi, eşitməsi, görməsi, bilməsi) Allahın bəndələrilə olması elmilədir və bu fikirdə ilk əsr imamları olmuşlar”[372].

***Nəticə:*** 1) Allahın yaratdıqları ilə bərabər olması Quran, Sünnə və Saleh Sələflərin icması ilə sabitdir. 2) Allahın yaratdıqları ilə bərabər olması Onun Ucalığına və Əzəmətinə yaraşır tərzdə olan bir haqqdır və bu yaradılmışların bir-birilərilə bərabər olmalarına bənzəməz. 3) Allahın yaratdıqları ilə bərabər olmasının mənası, Allahın məxluqatından elmi, eşitməsi, görməsi, bilməsi ilə xəbardar olmasıdır. 4) Buradan belə anlaşılmaz ki, Allah yaratdıqları ilə eyni məkanı paylaşdırır. 5) Allahın yaratdıqları ilə bərabər olması Onun Ərşin üzərinə İstiva etməsinə zidd deyildir. Əgər səndən: «Bərabərlik Allahın zatı sifətlərindəndir, yoxsa feli sifətlərindəndir?» deyə soruşularsa cavabımız: «Ümumi bərabərlik Allahın zatı sifətlərindəndir. Çünki bunlar əzəldən əbədi Allahda vardır. Xüsusi bərabərlik isə Allahın feli sifətlərindəndir».

## ALLAH - *Subhənəhu Və Təalə* - nin KƏLAM SİFƏTİ

Bu xüsusda da insanlar çaşqınlığa düşmüşlər. Əhli Sünnə vəl Cəmaata görə Allah hər zaman istədiyi vaxt danışır. Müxaliflərin dediyi kimi, Allahın kəlam sifəti ondan ayrı və məxluq deyildir. Kəlam Allahın zatı sifətlərindəndir. Allah dilədiyi kimi hərf və səslə danışır. Allah, Adəm və Həvva – *əleyhimussəlam* - ilə səslə danışmış, Musa – *əleyhissəlam* - ilə vasitəsiz danışmış, həmçinin də Qiyamət günü qulları ilə tərcüməçi olmadan danışacaqdır. ***«Allahdan daha doğru danışan kim ola bilər».*** *(ən-Nisa 87,122).* ***«Rəbbin sözü düzgün və ədalətli şəkildə tamam oldu».*** *(əl-Ənam 115).* ***«Biz Peyğəmbərlərin bəzisini digərindən üstün etdik. Allah bunlardan bəzisi ilə danışmışdır».*** *(əl-Bəqərə 253).* İmam Əbu Hənifə – *rahmətullahi aleyhi* – deyir: «Allah öz kəlamı ilə danışır. Kəlam Onun əzəli sifətidir», «Allah danışır, lakin bizim danışmağımız kimi deyildir» .

***«Xatırla ki, o zaman*** *(Qiyamət günü)* ***Allah buyuracaq: Ya Məryəm oğlu İsa! Sənmi insanlara: Allahla yanaşı məni və anamı da özünüzə ilah bilin! demişdin?»*** *(əl-Maidə 116).* Allahın Qiyamət günü İsa – *əleyhissəlam* - ilə danışması onun ilah olmamasını sübut etmək üçün olacaqdır.

***«Rəbbi onlara*** *(Adəm və Həvvaya)* ***müraciət edib buyurdu: Məgər mən sizə bu ağaca*** *(yaxınlaşmağı)* ***qadağan etməmişdimmi?».*** *(əl-Əraf 22).* Buradakı səsləniş, nida onların günah etmələrindən sonra olmuşdur. Həmçinin Qiyamət günü Adəm – *əleyhisəlam* - ilə danışması. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah (Qiyamət günü): «Ey Adəm!» deyə buyurur. Adəm: «Ya Rəbbim! Mən sənin qarşındayam. Əmr et, hər əmrini yerinə yetirim və hər xeyir bütünlüklə sənin əlindədir» deyə cavab verir. Allah ona səslə: «Soyundan Cəhənnəmə girəcəkləri seçib çıxarmağı əmr edir!». Adəm: «Ya Rəbbim! Cəhənnəmə girənlərin sayı nə qədərdir?» deyə soruşur. Allah: «Hər min nəfərdən **999**-zu! Hər bir hamiləli qadının bari-həlmini (vaxtından əvvəl) yerə qoyması və uşaqların saçlarının ağaracağı zaman o, zamandır. ***«İnsanları sərxoş görərsən, halbuki onlar sərxoş deyillər. Bu ancaq Allahın əzabının şiddətli olmasındandır!».***

---

[372] “Fətava əl-Həməviyyə”.
[373] «Fikhul Əkbər» s. 58,59.

*(əl-Həcc 2).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in bu cavabı oradakılara (səhabələrə) çox ağır gəldi. Elə ki, hətta üzlərinin rəngi də dəyişdi. Oradakılar: «Ya Rəsulullah! (Cəhənnəmdən qurtulan) Bu mindən bir nəfər kimdi?» deyə soruşdular. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sevinin ki, sizdən bir nəfərə Yəcuc və Məcucdan min nəfər» deyə buyurdu. Sonra sözünə davam edərək: «Nəfsim əlində olan Allaha and olsun ki, mən sizlərin Cənnət əhlinin dördə birini təşkil edəcəyinizə ümüd edirəm» deyə buyurdu. Sonra Allaha həmd etdik və təkbir gətirdik. Sonra yenə də: «Nəfsim əlində olan Allaha and olsun ki, mən sizlərin Cənnət əhlinin üçdə birini təşkil edəcəyinizə ümüd edirəm» deyə buyurdu. Bundan sonra biz yenə də Allaha həmd etdik və təkbir gətirdik. Sonra Peyğəmbər: «Nəfsim əlində olan Allaha and olsun ki, mən sizlərin Cənnət əhlinin yarısını təşkil edəcəyinizə ümüd və arzu edirəm» deyə buyurdu. Çünki ümmətlərə nisbətdə sizin məsəliniz qara öküzün dərsi üzərindəki ağ bir tük kimidir (Başqa rəvayətdə: «Ağ öküzün dərsi üzərindəki qara tük kimi») və ya Eşşəyin ön ayaqlarının iç tərəfində olan dairə formasında möhür kimi» .

***«Musaya vəd etdiyimiz vaxt gəlib çatanda Rəbbi onunla*** *(arada heç bir vasitə olmadan)* ***danışdı».*** *(əl-Əraf 143).* ***«Allah Musa ilə sözlə danışdı».*** *(ən-Nisa 164).* Musa – *əleyhissəlam* - ilə heç bir mələyin köməyi olmadan, vasitəçi olmadan danışmışdır. ***«Biz Musanı Tur dağının sağ tərəfindən səslədik».*** *(Məryəm 52).* ***«Yadına sal ki, bir zaman Rəbbin Musaya belə buyurmuşdu: Get o, zalım tayfanın yanına».*** *(əş-Şuəra 10).* İmam Əbu Hənifə – *rahmətullahi aleyhi* – deyir: ***«Allah Musa ilə sözlə danışdı».*** *(ən-Nisa 164)* ayəsində buyurduğu kimi Musa Allahın kəlamını eşitdi. Şübhəsiz Allah Musa ilə danışmadan öncə də Mutəkəllim (danışıcı) idi», «Allah Musa ilə əzəli sifəti olan kəlamıyla danışmışdır» . Başqa bir yerdə: «Biz Allahın Musa ilə danışdığına da iman, təsdiq və təslimiyyət olaraq söləyirik» . Əbu Yəla, İmam Əhməd – *rahmətullahi aleyhi* – belə dediyini rəvayət edir: «Mən atamdan, Allah Musa ilə danışdıqda səs ilə onunla danışmadı deyən bir topluluq haqqında soruşdum». Atam: «Allah bir səs ilə danışdı və biz bu hədisləri gəldikləri kimi rəvayət edirik» .

***«Allah həmin gün onlara xitab edib belə buyuracaqdır: Peyğəmbərlərə nə cavab verdiniz?»*** *(əl-Qəsəs 65).* ***«Rəhmli Allahda*** *(onlara)* ***salam deyiləcəkdir».*** *(Yasin 58).* Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurur: «Qiyamət günü Allah ilə qulun arasında heç bir tərcüməçi (vasitə) olmadan Allahın danışmadığı heç bir qul yoxdur» .

Möminlərdən fərqli olaraq Allahın Qiyamət günü ***«Allah onlarla danışmaz…».*** *(əl-Bəqərə 174).* ***«Allah ilə olan əhdlərini və andlarını ucuz bir qiymətə satan şəxslərə axirət nemətlərindən heç bir pay yoxdur. Allah Qiyamət günündə onları dindirməz….».*** *(Ali-İmran 77).* Onlarla danışmaması onlar üçün bir əzabdır. ***Allah buyurar: «Orada zəlil, məyus vəziyyətdə durub qalın və mənə heç bir şey deməyin».*** *(əl-Muminun 107).*

Bu ayələrdən göründüyü kimi Allah kəlam sifətinə malikdir və yaradılmış məxluqların səs və həriflərinə bənzəməz. Onun danışması vəhiydir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurur: «Allah bir əmri vermək istədikdə vəhy ilə

---

[374] Buxari 3348,4741,6530,7483, Müslim 222, Əhməd 2/166, 3/32-33, Tirmizi 3168,3169, əl-Albani "Səhih Cəmius Sağir" 8142, "Mişkət" 5541.
[375] «Fikhul Əkbər» s. 58,59.
[376] «Əqidətul Təhaviyyə» əl-Albani təhqiqi ilə s. 293.
[377] «Tabaqatul Hanabilə» 1/185.
[378] Buxari, Müslim.

danışır»   . Allahdan daha doğru söz söyləyən olmadığı üçün hər bir şeyi hər baxımdan gözəl bilən də odur.

# QİYAMƏT GÜNÜ MÖMİNLƏRİN RƏBLƏRİNİ GÖRMƏLƏRİ[380]

Əhli Sünnə Vəl Cəmaat yəni Sələfi Salihin ittifaq ilə bu fikirdədirlər ki, Qiyamət günü möminlər öz Rəblərini heç bir əziyyət çəkmədən görəcəklər. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və salləm* – in zamanında bir qurup insanlar: «Ya Rəsulullah! Qiyamət günü Rəbbimizi görəcəyikmi?» Rəsulullah – *sallallahu aleyhi və salləm* – buyurdu: «Yanında bulud olmayan açıq bir havada günəşi görməyə çətinlik çəkirsinizmi? Bədirlənmiş ayı **14-**cü günündə yanında bulud olmayan açıq havada görməyə çətinlik çəkirsinizmi?» Xeyr, Ya Rəsulullah! O, buyurdu: «Günəşi və ayı görməkdə əziyyət çəkmədiyiniz kimi Allahı görməkdə də əziyyət çəkməyəcəksiniz»[381]. Abdullah b. Qeys - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və salləm* – buyurdu: «İki Cənnət vardır ki, qabları və içindəki (digər əşyaları) da gümüşdəndir. Digər iki Cənnət daha vardır ki, qabları və içindəki digər əşyaları da qızıldandır. Ədn Cənnətindəki topluluğun Rəblərinə baxmalarının qarşısında Allahın üzündəki o, əzəmət örtüyündən başqa bir şey olmayacaqdır»[382]. Adiy b. Hatim - *radıyallahu anhu* – rəvayət edir ki, Mən Peyğəmbər – *sallallahu aleyhi və salləm* – in yanında ikən bir nəfər gəlib yoxsulluqdan şikayət etdi. Sonra digər bir nəfər gəldi və yol kəsən quldurlardan şikayət etdi. Peyğəmbər: "Ey Adiy! Hirə şəhərini gördünmü?" deyə buyurdu. Adiy: "Xeyr, yalnız eşitdim" dedim. Peyğəmbər: "Əgər ömrün uzun olsa dəvə üzərində bir qadının Allahdan başqa kimsədən qorxmadan Kəbəyə gəlib təvaf edəcəyini görəcəksən" deyə buyurdu. Öz-özümə: "Bizim Tai qəbiləsinin yol kəsənləri varaaa! (Onların əlindən hara gələ bilər)" dedim. Peyğəmbər: "Əgər ömrün uzun olsa Kisranın xəzinələrinin fəth ediləcəyini görəcəksən" deyə buyurdu. Mən: "Kisra b. Hurmuzmu?" dedim. Peyğəmbər: "Bəli, Kisra b. Hurmuz və əgər ömrün uzun sürərsə qızıl və gümüş dolu kisəsini çıxarıb zəkat vermək istəyən adamı görürsən. Lakin zəkat alacaq kimsə olmayacaqdır (tapmayacaqdır). Hər biriniz mütləq bir gün gələcək aranızda heç bir pərdə, tərcüməçi olmadan Allahla qarşılaşacaqsınız. O, zaman Allah: "Səni təbliğ edən bir Peyğəmbər göndərmədimmi?" deyə buyuracaq. O: "Bəli, göndərdin" deyəcəkdir. Allah: "Mən sənə mal vermədimmi? İkram etmədimmi?" deyə soruşacaq. Qul: "Bəli, Ey Rəbbim, verdin" deyib sağına baxacaq Cəhənnəmdən başqa bir şey görməyəcəkdir, soluna baxacaq Cəhənnəmdən başqa bir görməyəcəkdir". Adiy - *radıyallahu anhu* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – in belə buyurduğunu eşitdim: "Bir xurmanın yarısı da olsa onu sədəqə verib özünüzü Cəhənnəmdən qoruyun. Kim yarım xurma tapmazsa gözəl bir sözlə qorunsun". Adiy: "Allahdan başqa kimsədən qorxmadan Kəbəni təvaf etməyə gedən dəvə üstündə yaşlı qadın gördüm. Kisra b. Hurmuzun xəzinələrini ələ keçirənlər arasında mən də var idim. Əgər sizin də ömrünüz uzun olarsa Əbul Qasımın xəbər verdiyi kisəsini çıxaran o, adamı görəcəksiniz" dedi[383].

---

[379] İbn Xuzeyfə «Kitabu Tövhid» 1/348, «Kitabus Sunnə» 1/227.
[380] Geniş Məlumat üçün bax: İbn Qeyyim "Hədiyul Ərvah – Cənnətdəki Həyat".
[381] Buxari 4581, Müslim 183, Darimi "Sünən" 6/81, H.2804.
[382] Buxari 4878,4879,4880, Müslim 180.
[383] Buhari "Mənakib" 25, Fəthul Bâri 6/610-611.

Muhəmməd b. Cəfər əl-Qattani, İmam Suyuti – *rahmətullahi aleyhi* – dən rəvayət edir ki: "Qiyamət günü Cənnətə möminlərin Rəblərini görmələri ağıl ilə mümkündür, Quran, Sünnə və İcma bunu təsdiq edir. *Quran*: ***«O, gün üzlər Rəbbinin gül cəmalına baxıb sevinəcəkdir».*** *(əl-Qiyamə 22-23).* ***"Yaxşı işlər görənləri Cənnət və daha artıq mükafat gözləyir...".*** *(Yunus 25-26).* ***«Qiyamət günü onlarla Rəbləri arasında hicab çəkiləcək və onlar Rəblərini görməyəcəklər».*** *(əl-Mutəffifin 15).* ***Sünnə***: Sünnəyə gəldikdə isə **20**-dən çox səhabədən gələn səhih hədislər bunun dəlilidir. ***İcma***: Sələf alimləri bidət əhli meydana gəlməmişdən öncə möminlərin Rəbblərini Cənnətdə görmələri üzərinə icma etmişlər[384]. İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: ***«O, gün üzlər Rəbbinin gül cəmalına baxıb sevinəcəkdir».*** *(əl-Qiyamə 22-23).* Onlar (möminlər) açıq-aydın öz Rəbblərini görəcəklər. Onlar öz Rəbblərinə baxacaqlar. Necə İmam Buxari – *rahmətullahi aleyhi* – "Səhih" əsərində: "Siz öz Rəbbinizi açıq-aydın görəcəksiniz". Mühəddislərə əsasən möminlərin Qiyamət günü Rəbblərini görmələri bizlərə "*Mutavatir*" yollarla çatmışdır. Bu rəvayətləri isə nə inkar, nə də rədd etmək olmaz"[385]. İbn Əbil İzz əl-Hənəfi – *rahmətullahi aleyhi* – deyir ki: "Allahı görmək – barədə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in hədisləri və səhabələrin sözləri *Mutavatirdi*"[386]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Peyğəmbər və səhabələrdən Allahı görmək barədə gələn rəvayətlər *Mutavatirdi*"[387]. İmam Təbəri – *rahmətullahi aleyhi* – deyir ki: "Möminlərin Qiyamət günü Rəblərini görmələri *Mutavatir* hədislərlə səhabələrdən bizə çatmış və zikr edilmişdir..."[388]. ***Mutavatir –*** Əbu Bakr, Əbu Hureyrə, Əbu Səid, Cərir b. Abdullah, Suheybə, İbn Məsud, Əli, Əbu Musa əl-Əşari, Adiy b. Xatim, Ənəs b. Məlik, Bureydə b. Həsib, Əbu Razin əl-Aqili, Cabir b. Abdullah, Əbu Umama, Zeyd b. Sabit, Ammar b. Yəsir, Aişə, İbn Ömər, Umara b. Ruvayba, Salman Farsi, Huzeyfə b. Yəmən, İbn Abbas, Abdullah b. Amr b. əl-Ass, Ubey b. Kəb, Fudeyl b. İyad, Ubadə b. Samit – *Allah Onların Hər Birindən Razı Olsun* - [389] Yəhyə b. Məin – *rahmətullahi aleyhi* – deyir ki: "Mən **17** hədis bilirəm Allahı görmək barədə və onların hər biri də səhihdir"[390]. Beyhəqi – *rahmətullahi aleyhi* – deyir ki: "Biz *Ruyətullahın* haqq olduğu barədə hədislər rəvayət etdik: Əbu Bəkr, Huzeyfə, İbn Məsud, İbn Abbas, Əbu Musa və s. səhabələrdən – *Allah Onlardan Razı Olsun* -. *Ruyətullahın* olmaması barədə bizlərə səhabələrdən heç bir rəvayət gəlməmişdir. Əgər onlar arasında bu məsələdə ziddiyət olsaydı bizə xəbər çatardı. Onlar Allahı Qiyamət günü görmək barəsində ittifaq etmişlər"[391]. İbn Abdul Bərr – *rahmətullahi aleyhi* – deyir ki, İmam Məlik – *rahmətullahi aleyhi* – dən soruşurlar ki: "Allahı Qiyamət günü görəcəyikmi?". O: "Bəli, ***«O, gün üzlər Rəbbinin gül cəmalına baxıb sevinəcəkdir».*** *(əl-Qiyamə 22-23).* Digər qrup haqqında: ***«Qiyamət günü onlarla Rəbləri arasında hicab çəkiləcək və onlar Rəblərini görməyəcəklər».*** *(əl-Mutəffifin 15)*[392]. Vaki b. Cərrah – *rahmətullahi aleyhi* – deyir ki: "Möminlər Onu Cənnətdə görəcəklər, möminlərdən qeyrisi onu görməyəcəkdir"[393]. İshaq b. Rahaveh –

[384] Qattani "Nazmul Mutanasira Minəl Hədis əl-Mutavati", "Mətailul Musirat".
[385] İbn Kəsir "Muxtəsər Təfsir".
[386] "Əqidətul Təhaviyyə".
[387] "Hədiyul Ərvah" 355.
[388] Təbəri "Təfsir Təbəri" 8/503.
[389] "Hədiyul Ərvah" 355-384.
[390] "Hədiyul Ərvah" 386, "Fəthul Bəri" 13/434,7009, Lələkai "Usulu Etiqad" 3/495,867.
[391] "Hədiyul Ərvah" 386.
[392] əl-İntiqa 36.
[393] "Hədiyul Ərvah" 385.

*rahmətullahi aleyhi* – Ruyatullahın haqq oluğunu söyləyənlər barəsində danışdıqda deyir ki: "Onlar haqqı söyləmişlər, buna müxalif olaraq inkar edən yalnız bidət əhli və dini savadı az olanlar olmuşlar"[394]. İmam Əhməd – *rahmətullahi aleyhi* – nin yanında *Ruyətullahı* iknar edən bir kimsədən söz edildi. İmam qəzəblənərək dedi: Kim desə ki, Qiyamət günü Rəbbimizi görməyəcəyik kafirdir, kim olursa olsun Allahın qəzəbi və lənəti onun üzərinə olsun. Məgər Allah buyurmadı: ***«O, gün üzlər Rəbbinin gül camalına baxıb sevinəcəkdir».*** *(əl-Qiyamə 22-23)*. Məgər Allah buyurmadı: ***«Qiyamət günü onlarla Rəbləri arasında hicab çəkiləcək və onlar Rəblərini görməyəcəklər».*** *(əl-Mutəffifin 15)*[395]. Hənbəl b. İshaq – *rahmətullahi aleyhi* – rəvayət edir ki, İmam Əhməd – *rahmətullahi aleyhi* – dedi: "Kim desə ki, Qiyamət günü Allah görülməyəcək – Cəhmidir, Allah və Rəsulunu inkar edən kafirdir"[396]. Əbu Davud əl-Misri – *rahmətullahi aleyhi* – deyir ki, Nəim b. Həmməd – *rahmətullahi aleyhi* – ilə bərabər oturmuşduq. Nəim, Muzəni – *rahmətullahi aleyhi* – soruşdu: "Sən Quran barəsində nə deyirsən?". O: "Allahın kəlamıdır". Həmməd: "Yəni, Məxluq deyildir?". Muzəni: "Bəli, yaradılmamışdır". Nəim: "Sən düşünürsən ki, Qiyamət günü Allahı Qiyamət günü (möminlər Cənnətdə) görəcəklər?". Muzəni: "Bəli" deyə cavab verdi[397].

***Əhli Sünnətdən Üç Görüş*** – Ibn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Allahın görülməsi ilə bağlı Əhli Sünnətdən üç görüş vardır: 1. Allahı sadəcə möminlər görəcəkdir. 2. Məhşərdə Allahı mömin, kafir hər kəs görəcəkdir. Sonra kafirlərə pərdələnəcək və bir daha görməyəcəklər. 3. Münafiqlər görəcəklər, kafirlər isə yox"[398].

# MÜXALİFLƏRİN GƏTİRDİKLƏRİ BƏZİ ŞÜBHƏLƏR VƏ ONLARA VERİLƏN CAVABLAR

***Müxaliflərin Şübhələri: «O, gün üzlər Rəbbinin gül camalına baxıb sevinəcəkdir».*** *(əl-Qiyamə 22-23)*. Müxaliflər qeyd edirlər ki: "Bu ayədə ***Baxmaq*** deyil, ***Gözləməkdir***. ***Cavab:*** Deyilir ki: Gözləmək qəlb ilə bağlı olan bir şeydir. Cənnətdə isə gözləmək ola bilməz, çünki o, əlaqəlidir narahatçılıq və kədərlə. Halbuki Cənnət əhli bu hissləri keçirməyəcəkdir. Onlar Cənnətin füsünkarlığından həzz alıb dincələcəklər və nəinsə intizarında olub gözləməyəcəklər. Həmçinin ayədə keçən ***İlə*** kəliməsi burada gözləmək deyil, Baxmaq olduğuna dəlildir". Bəziləri də qeyd edirlər ki: Baxmaq kəlməsindən qəsd – Allahın onlara verəcəyi mükafata baxacaqlar deməkdir. ***Cavab:*** *Subhənəllah!* Məgər ayədə Allah buyurur ki: "Onlar Allahın onlara nə mükafat verəcəyinə baxacaqlar". Kim bu cür təfsir verib. Ayələri təvil etmək olmaz. Allah buyurur: ***«O, gün üzlər Rəbbinin gül camalına baxıb sevinəcəkdir».*** *(əl-Qiyamə 22-23)*. Müxaliflərin söylədiyi kimi əgər bu mümkün olmasaydı, onda belə çıxır ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in bilmədiyi bir məsələni müxaliflər bilirdilər və onlar Allahdan daha çox xəbərdar idilər. *Allah Qorusun*!

***Müxaliflərə Cavab:*** Bu ayə altı kəlmədən ibarətdir ki, bunların beşi Allahın görülməsinə dəlalət edir. ***«O, gün üzlər Rəbbinin gül camalına baxıb sevinəcəkdir».*** *(əl-Qiyamə 22-23)*.

---

394 "Hədiyul Ərvah".
395 "Hədiyul Ərvah".
396 "əl-Qovl Əhməd b. Həbəl Fi Cərh və Tadil" 4303, "Hədiyul Ərvah" 392.
397 "Hədiyul Ərvah" 393.
398 "Hədiyul Ərvah" 347.

**1. *Vucuhun*** – üzlər: Müxaliflər qeyd edirlər ki, bu ayədə olan görmək qəlbnəndir. Lakin bu səhv fikirdir. ***Raəə*** – sözü ərəb dilində iki cürdür: **1). *Bəsariyyə*** – gözlə. **2). *Qulubun*** – qəlblə. Allah: "***Qulubun*** – qəlblər o, gün sevinəcək" deyə buyurmadı. Əksinə Allah buyurdu: ***Vucuhun*** – üzlər o, gün sevinəcək. Gözlər də üzdə olduğu üçün nəzər salacaqdır. Bir məsələ də var ki, qəlb nəzər sala bilməz, gözlər isə nəzər sala bilər. Ayədə keçən üzlər kəliməsi ona dəlildir ki: Möminlər üzlərində yerləşən iki gözlərilə baxacaqlar. ***"Biz sənin üzünün göyə tərəf çevrildiyini gördük və Biz səni razı qalacağın qibləyə tərəf döndərəcəyik. Sən üzünü Məscidulharama tərəf çevir! Harada olursunuzsa olun, üzünüzü ona tərəf çevirin!".*** *(əl-Bəqərə 144).* Bu ayədə də üzünün göyə tərəf çevrildiyini Allah buyurur. Aydındır ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – səmaya baxdığı zaman iki gözü ilə baxardı".

**2. *Yəuməizin*** – o, gün: Məgər qəlb Allahın olduğunu bilmir. Hətta kafir belə olsa çətin anlarında əllərini göyə qaldıraraq dua edir. Lakin Allahın o, günü xüsusiləşdirməsi məhz möminlərin öz Rəbblərini görəcəyinə işarədir.

**3. *Nədira*** – üzlər ağ, sevinc içində: Nə üçün Allah möminləri ayırdı, onları sevinc içərisində olacaqlarını buyurdu. Çünkü möminlərdən fərqli olaraq kafirlər o günü öz Rəbblərini görməyəcəklər. ***«Qiyamət günü onlarla Rəbləri arasında hicab çəkiləcək və onlar Rəblərini görməyəcəklər».*** *(əl-Mutəffifin 15)* İmam Şafii – *rahmətullahi aleyhi* – deyir ki: «Bu buyuruqla Allah bizlərə qarşı pərdələnməyəcəyini, ona baxacaq və onu görməkdə hər hansı bir çətinliklə qarşılaşmayacaq bir topluluq olacağını bildirmişdir» .

**4. *İlə*** – tərəf: Yəni, Rəblərinə tərəf baxacaqlar. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər– *sallallahu aleyhi və səlləm* – in zamanında bir qurup insanlar: «Ya Rəsulallah! Qiyamət günü Rəbbimizi görəcəyikmi?» deyə soruşdular. (Peyğəmbər): «Bədirlənmiş ayı yanında bulud olmayan açıq havada görməkdə şübhə edirsinizmi?». Onlar: «Xeyr, Ya Rəsulallah!» dedilər. (Peyğəmbər): «Yanında bulud olmayan açıq havada günəşi görməkdə şübhə edirsinizmi?». Onlar: «Xeyr, Ya Rəsulallah!» dedilər. (Peyğəmbər): «Sizlər onu (Allahı) beləcə görəcəksiniz?» deyə buyurdu. Qiyamət günü insanlar bir yerə toplanacaqlar. Allah: «(Dünyada ikən) Kim nəyə ibadət edirdisə onun ardınca düşsün!» deyə buyurur. Onlardan kimiləri günəşin, kimiləri ayın, kimiləri də tağutların[400] ardınca düşürlər. Bu ümmət isə münafiqləri də içində olduqları halda (yerlərində) durub qalırlar. Allah onların yanlarına (tanıdıqlarından başqa bir surətdə) yaxınlaşıb: «Mən sizin Rəbbinizəm!» deyə buyurur. Onlar da: «Rəbbimiz gələnə qədər bizim yerimiz buradır. Buradan heç bir yana tərpənməyəcəyik. Rəbbimiz gəldikdə isə biz onu tanıyacağıq (sən bizim Rəbbimiz deyilsən)» deyirlər. Bundan sonra Allah (ikinci dəfə) onların yanına gəlir və: «Mən sizin Rəbbinizəm!» deyə buyurur. Onlar da: «Bəli, sən bizim Rəbbimizsən!» deyirlər[401].

**5. *Nazira*** **–** nəzər salacaqlar: Müxaliflər şübhə salmaq üçün bu ayəni dəlil gətirirlər. ***«Gözlər onu dərk edə bilməz, lakin o, gözləri dərk edər».*** *(əl-Ənam 103).* Baxış (nəzər) bölünür qəlbin baxışına və bir də göz baxışına. ***"Həqiqətən, gözlər kor olmaz, lakin sinələrindəki ürəklər*** *(qəlb gözü)* ***kor olar".*** *(əl-Həcc 46).* Bu ayədə qəsd olunan

---

[399] əl-İntiqa s. 79.
[400] ***Tağut*** **–** tüğyan sözündəndir. Həddi aşmaq deməkdir. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir: "Tağut bəndənin ibadətdə, itaətdə və tabeçilikdə ifrata varması, həddi aşmasıdır. Allah və Rəsulunu buraxıb onların əvəzində ibadət etdiyi, itaət etdiyi və ardınca getdiyi kimsə deməkdir".
[401] Buxari 806, Müslim 182.

qəlb baxışıdır. Ərəblər deyirlər ki: “Filankəs bəsirətli (gözüaçıqdır) öz sənətində”. Bu sözlə ərəblər o, kimsənin öz sənətinin mahir biləni olduğunu söyləmiş olurlar. Həmçinin Ərəblər deyirlər ki: “Filankəs qəlbi ilə gördü və ya gözü ilə gördü”. Bütün bu kəlimələr Ərəblərdə işlədilir və dəlildir ki, göz baxışından başqa qəlb (gözü) baxışı da vardır. Əgər biz Allahı gözlərimizlə dərk etmək qabiliyyətinə malik deyiliksə bu o, demək deyil ki, biz Onu görə bilmərik. Göz ilə Allahı görmək, Onu dərk etmək deyildir, həmçinin Allahı qəlb ilə bilmək (anlamaq) Onu büstbütün dərk etmək deyildir. Sözsüz ki, nə bu dünyada, nə də axirətdə Allahı heç bir məxluq dərk edə bilməz. Lakin insan baxdığı, bir şeyi görə bilər, lakin dərk etməyə bilər. Ağıllar onu bilirlər, lakin bilməkləri ilə onu dərk edə bilmirlər. İbn Abbas - *radıyallahu anhu* – deyir ki: “***Gözlər onu dərk edə bilməz*** - Onu əhatə edə bilməzlər” deməkdir[402]. Qatadə - *radıyallahu anhu* – deyir ki: “O, gözlər onu idrak edə bilməyəcək qədər böyükdür”[403]. Atəyyə - *rahmətullahi aleyhi* - deyir ki: “Allaha baxarlar, əzəmətindən dolayı gözlər Onu əhatə edə bilməz”[404]. Çünki hər bir şeyi Elimi ilə əhatə edən Allahı bir şeylər tərəfindən əhatə edilə biləcəyini söyləmək caiz deyildir. Buna görə də dərk etmək tamamilə ayrı bir şey, görmək isə tam başqa bir şeydir. ***«Onlar taxtlar üstündə*** *(əyləşib)* ***tamaşa edəcəklər».*** *(əl-Mutəffifin 24)* İmam Əhməd – *rahmətullahi aleyhi* – deyir ki: «Allahın axirətdə görülməyəcəyini iddi edən bir kimsə kafirdir və Quranı yalanlayan bir kimsədir»[405].

***Müxaliflərin Digər Şübhələri: «Musa təyin etdiyimiz vaxtda*** *(Tur-i Sinaya)* ***gəldikdə Rəbbi onunla*** *(arada heç bir vasitə olmadan)* ***danışdı.*** *(Musa)* ***“Ey Rəbbim! Özünü*** *(camalını)* ***mənə göstər. Sənə baxım!” – dedi. Allah: “Sən Məni əsla görə bilməzsən. Lakin*** *(bu)* ***dağa bax. Əgər o yerində dura bilsə, sən də Məni görə bilərsən” - buyurdu. Rəbbi dağa təcəlli etdikdə*** *(Allahın nuru dağa saçıldıqda)* ***onu parça-parça etdi. Musa da bayılıb düşdü. Ayılandan sonra isə: “Sən paksan, müqəddəssən!*** *(Bütün eyib və nöqsanlardan uzaqsan!)* ***Sənə*** *(bu işimdən ötrü)* ***tövbə etdim. Mən iman gətirənlərin birincisiyəm!” – dedi».*** *(əl-Əraf 143).* Müxaliflərin dediyinə görə bu ayədə olan ***Lən Tərani –*** kəlməsi əbədiyyən nəfy (inkar) ifadə edər. Bu görmənin heç vaxt həqiqət olmayacağına dəlalət edir. ***Cavab:*** Bu ayə elə onların özləri üçün bir dəlildir. Bu dil baxımdan da doğru deyildir. Allah Qurani Kərimdə Yəhudilər haqqında buyurur: ***«Yəhudilər deyirlər ki, bizim yerimiz Cənnətdir. Orada bizə gözəl nemətlər hazırlanıb.*** *(Ya Muhəmməd!)* ***Sən onlara*** *(yəhudilərə)* ***de: Əgər*** *(sizin iddianıza görə)* ***Allah yanında axirət evi*** *(Cənnət)* ***başqa insanlara deyil, yalnız sizə məxsusdursa və bu sözünüz doğrudursa*** *(Allahdan)* ***ölüm istəyin!*** *(Cənnətin yalnız özünə aid olduğunu iddia edən kimsə ona qovuşmağa səbəb olan ölümü mütləq arzular).* *(Əlbətdə)* ***onlar öz əməllərini bildiklərinə görə ölümü əsla istəməzlər».*** *(əl-Bəqərə 95-96).* Ayədən də görüldüyü kimi ***Lən*** - onlar ölümü bu dünyada təmənna etməyəcəklər. Digər bir ayədə isə: ***«Onlar müraciət edib deyəcəklər: Ey Məlik! Qoy Rəbbin bizi öldürsün*** *(bu əzabdan qurtaraq).* ***O, isə*** *(min ildən sonra onlara)* ***Siz*** *(həmişəlik burada)* ***qalacaqsınız».*** *(əz-Zumər 77).* Cəhənnəmdə isə ölümü təmənna etdiklərini görürük. ***Həmçinin*** - Musa - *əlehissəlam* - Allahın Rəsulu, onun kəlimi olduğu halda, Allah haqqında nəyin imkansız olduğunu daha yaxşı bilirdi. Əgər onun

---

[402] Qurtubi 7/54-55, “Durrul Mənsur” Təfsir Yunus 26.
[403] İbn Kəsir 2/167.
[404] Qurtubi 19/110.
[405] «Tabaqatul Hənbəliyə» 1/59,145.

görülməsi imkansız olsaydı belə bir istəklə Allaha müraciət etməzdi. Peyğəmbərlərin həyatlarına baxsaq görərik ki, onlar Allaha layiq olamayan bir şeylə müraciət etdikdə Allah onları dərhal düzəldərdi. Məs: Nuh - *əlehissəlam* - öz oğlu üçün kömək istədikdə, İbrahim - *əlehissəlam* - öz atası üçün, Muhəmməd – *sallallahu aleyhi və səlləm* – öz əmisi üçün kömək istədikdə Allah onlara qadağan etdi. Musa - *əlehissəlam* – a isə bu qadağanı qoymadı, əksinə: «Tur dağına bax» deyə buyurdu. Buna görə də Allah: «Sən məni əsla görə bilməzsən» – buyurduğunun mənası, dünyada məni görə bilməyəcəksən deməkdir. ***"Allahdan qorxun və** (Qiyamət günü) **Onun hüzuruna gedəcəyinizi bilin!".*** *(əl-Bəqərə 223).* ***"**(Möminlərin)* ***Ona qovuşacaqlarını gün*** *(Cənnətdə bir-birinə)* ***xeyir-duaları*** *(və ya Allahın onlara verəcəyi xeyir-dua)* ***"Salam"dır!*** *(Allah)* ***onlar üçün çox qiymətli*** *(tükənməz, gözəl)* ***mükafat hazırlamışdır".*** *(əl-Əhzab 44).* ***"Ey insan! Sən*** *(ölənə qədər)* ***Rəbbinə doğru çalışıb çabalayırsan. Sən Ona qovuşacaqsan!".*** *(əl-İnşiqaq 6).* Qramatika alimləri ittifaq ediblər ki: "***Qovuşmaq*** **–** diri bir varlığa nisbət edilirsə - ***Görmə*** - mənasındadır"[406].

***Müxaliflərə Cavab: «Qiyamət günü onlarla Rəbləri arasında hicab çəkiləcək və onlar Rəblərini görməyəcəklər».*** *(əl-Mutəffifin 15).* Bu kafirlər üçün ən böyük əzabdır. Allah kimi Özündən hicab ilə pərdələmişsə o, kimsə mütləq əzab görəcəkdir. İbn Kəsir, İmam Şafii – *rahmətullahi aleyhi* – nin sözlərini zikr edərək deyir ki: "Bu ayə dəlildir ki, möminlər ilə Rəbləri arasında hicab olmayacaqdır"[407]. Rabiya b. Suleyman – *rahmətullahi aleyhi* – deyir ki, İmam Şafii – *rahmətullahi aleyhi* – nin dərsində idim. Ona: ***«Qiyamət günü onlarla Rəbləri arasında hicab çəkiləcək və onlar Rəblərini görməyəcəklər»*** ayəsi barəsində nə deyərsiniz deyə bir kağız parçasında sual verildi. Şafii: ***«Qiyamət günü onlarla Rəbləri arasında hicab çəkiləcək və onlar Rəblərini görməyəcəklər»*** - möminlər (Rəbblərindən) mükafat olaraq Onu görəcəklər..."[408].

***Müxaliflərə Cavab: "Yaxşı işlər görənləri Cənnət və daha artıq*** *(əlavə)* ***mükafat gözləyir...".*** *(Yunus 25-26).* ***Artıq*** *(əlavə)* – Cənnətdə isə bu mükafat Rəbbinin Vəchinə baxmaqdır. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – bu ayəni oxudu: Yaxşı işlər görənləri Cənnət və daha artıq mükafat gözləyir – Cənnət əhli Cənnətə, Cəhənnəm əhli Cəhənnəmə girdiyi zaman bir Carçı: Ey Cənnət əhli! Sizə Allahın bir sözü vardır. Sizə verdiyi vədi yerinə yetirmək istəyir" deyə səsləyər. Onlar: "Tərəzilərimiz ağır gəlmiş, üzlərimizi ağartmış, bizi Cənnətə salmış və Cəhənnəmdən uzaqlaşdırmışdır". Bu zaman Allah pərdəni qaldırar. Onlar üçün Rəblərinə baxmaqdan daha sevimli bir şey verilməmişdir. ***Artıq*** *(əlavə)* **–** budur"[409]. Əbu Musa - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Allah Qiyamət Günü bir Munadi (Carçı) yollayar. Munadi uzaq və yaxın olan hər bir kəsin eşidəcəyi bir səslə: "Ey Cənnət əhli! Allah sizə ən gözəlini vəd etmişdir? Ən gözəli Cənnət, ***Artıq*** (əlavə) – isə Allahın vəchinə baxmaqdır"[410]. Əbu Bəkr əs-Sıddıq, Xuzeyfə - *radıyallahu anhum* – dan Cənnətdə olan ***Artıq*** *(əlavə)* nədir deyə soruşduqda onlar: "Bu Allahın Kərim vəchinə baxmaqdır" demişlər[411]. Darakutni və İbn Mərvədi - *rahmətullahi aleyhi* -, Suheyb - *radıyallahu anhu* – dan rəvayət edirlər ki, Peyğəmbər – *sallallahu aleyhi və*

[406] "Hədiyul Ərvah" 346.
[407] "Hədiyul Ərvah" 350, Ləlkai "Usuli Etiqad".
[408] "Hədiyul Ərvah" 350.
[409] Müslim 181, Tirmizi 3/81, İbn Məcə 17, İbni Kəsir "Nihayə" 2/481, İbni Cərir 11/74.
[410] İbn Kəsir "Nihayə" 2/481, İbn Cərir "Təfsir" 11/74.
[411] Qurtubi 8/330, İbn Cərir 11/74, "İbn Qeyyim "Hədiyul Ərvah" 348.

*səlləm* – buyurdu: “***Artıq*** – Allahın Vəchinə baxmaqdır”[412]. Əbu Hureyrə - *radıyallahu anhu* – deyir ki: “Ölümü dadmadıqca Rəbbinizi görməyəcəksiniz”[413]. Təbəri - *rahmətullahi aleyhi* - rəvayət edir ki: “Əbu Bəkr, Huzeyfə, Amir b. Sad, Əbu İshaq, Əbu Musa, Əbu Leylə, Həsənul Bəsri, AbdurRahman b. Mehdi, Suheyb ər-Rumi, Qatadə, Kab b. Ucra, Ubey b. Kəb – *Allah Onlardan Razı Olsun* – deyirlər ki: ***“Yaxşı işlər görənləri Cənnət və daha artıq** (əlavə) **mükafat gözləyir...”.** (Yunus 25-26).* Ayənin təfsirində ***Artıq** (əlavə)* – Allahın vəchinə baxmaqdır” deyə təfsir etmişlər[414]. Mucahid, Səid b. Museyyib, Həsənul Bəsri – *Allah Onlardan Razı Olsun* – deyirlər ki: “***Artıq** (əlavə)* – Allahın vəchinə baxmaqdır”[415]. Hişam b. Həsən - *rahmətullahi aleyhi* - deyir ki: “Allah (möminlərə) Cənnəti göstərəcəkdir. Onlar Cənnətin ləzzətlərini Allahı gördükləri zaman unudacaqlar”[416]. Səid b. Cubeyr - *rahmətullahi aleyhi* - deyir ki: “Cənnətin ən hörmətli sakinləri səhər-axşam Rəblərini görənlərdir”[417]. İmam Əhməd - *rahmətullahi aleyhi* - deyir ki: “Kim Allahın (Qiyamət günü) görülmədiyini etiqad edərsə o, kimsə kafirdir. (Başqa rəvayətdə: Zındıqdır)”[418]. Ukbə b. Xabis - *rahmətullahi aleyhi* - deyir ki: “Bir gün Əbu Nuaym - *rahmətullahi aleyhi* – nin yanına gəldik. Evindən düşərək bizim yanımıza gəlib oturdu. Üzündən qəzəbli olduğunu gördük”. O: “Şureyh b. Abdullah ən-Nəhai deyir ki: De, mühacirlər bizə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən rəvayət edirlər ki, (möminlər Cənnətdə) Allahı görəcəklər, bu Yəhudi balası (Bişr əl-Marisi) deyir ki: Allahı görməyəcəyik”[419]. Sufyan b. Uyeynə - *rahmətullahi aleyhi* – deyir ki: “Kim – Quran Allahın kəlamıdır, Allahı Cənnəttə görəcəklər - deyə etiqad etməzsə o, kimsə Cəhmidir”[420].

***Müxaliflərə Cavab: «Etdikləri əməllərin mükafatı olaraq** (Allah dərgahında) **möminlər üçün göz oxşayan** (onları sevindirəcək) **nə cür nemətlər gizlənib saxlandığını heç kəs bilməz».** (əs-Səcdə 17).* Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Əziz və Cəlil olan Allah: Mən yaxşı qullarım üçün heç bir gözün görmədiyi, heç bir qulağın eşitmədiyi və heç bir insanın qəlbindən keçirmədiyi şeylər hazırladım” buyurdu. Allah Kitabında bunu təsdiqləyən dəlil bu ayədir: “Etdiklərinin əvəzi olaraq onlar üçün nə kimi şeylər saxlandığını heç kimsə bilməz”[421]. Bütün bu nemətlər - ***Heç Bir Gözün Görmədiyi, Heç Bir Qulağın Eşitmədiyi Və Heç Bir İnsanın Qəlbindən Keçirmədiyi Şeylər*** - möminlər üçün Cənnətdə hazırlanmışdır. Bu nemətlər içərisində ən böyük nemət isə Uca və Böyük Rəbbinin Cəmalına tamaşa etmək nemətidir. Möminlər illər boyu etdikləri ibadətlərinin bir mükafatı olaraq Rəbblərinin Cəmalına tamaşa etmək arzusundadırlar. Allah – *subhənəhu və təalə* - Peyğəmbərlərini, Elçilərini, Saleh qullarını Onun Cəmalına baxmaq nemətindən heç vaxt məhrum etməz. Allah bizlərə Onun gözəl Cəmalına baxmağı nəsib etsin! Amin! Ya Rəbbim, Amin!

---

412 “Durrul Mənsur” Yunus 26, Təfsir “Cəlaleyn” 2/98.
413 “Hədiyul Ərvah” 385, Lələkai “Usulu Etiqadi” 3/499, 865,
414 “Təfsir Təbəri” 4/412, Darimi “Raddu Alə Cəhmi” 102,103.
415 “Muxtəsər İbn Kəsir Təfsir” 3/460,463, №789,790.
416 “Hədiyul Ərvah” 387, İbn Batta “İbana” 3/40.
417 “Hədiyul Ərvah” 387.
418 “Hədiyul Ərvah” 391,392.
419 “Hədiyul Ərvah” 388.
420 “Hədiyul Ərvah” 389.
421 Buxari 13/465, Müslim 2824.

## ALLAH - *Subhənəhu Və Təalə* - nin ƏL SİFƏTİ

***Allah dedi: «Ey İblis! Sənə Mənim iki əlimlə yaratdığıma səcdə etməyə mane olan nə idi? Təkəbbür göstərdin, böyüklərdənmi olmuşdun?"»*** *(Sad 75).* ***«Allahın əli onların əllərinin üstündədir».*** *(əl-Fəth 10).* Ancaq bu yaratdıqlarının əlləri kimi deyildir, bir üzüv (orqan) da deyildir. O, əllərin yaradıcısıdır. ***«Onun bənzəri heç bir şey yoxdur».*** *(əş-Şura 11)* . ***«Hökm əlində olan Allah nə qədər uca və nə qədər uludur. O, hər şeyə qadirdir».*** *(əl-Mulk 1).*

Əhli Sünnə Vəl Cəmaatın bu ayələrdə mövqeyi ayələri olduğu kimi qəbul etmək, onları müxaliflər kimi qüdrət, nemət kimi mənalarla təvil etməməkdir. Əbu Hənifə – *rahmətullahi aleyhi* – deyir: «Allahın əlindən məqsəd qüdrətdir və ya nemətdir deyilməz. Çünki bu durumda Allahın sifətləri iptal olunmuş olur. Bu isə Mutəzilə və Qədəriyyənin görüşüdür. Lakin Allahın əli Onun necəliyi bilinməyən sifətidir. Abdullah b. Amr - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah üç şeyi əli ilə yaratmışdır. Adəmı, Tövratı əli ilə yazmışdı və Ədn Cənnətindəki (ağacları da) əli ilə əkmişdi» . İbn Ömər - *radıyallahu anhu* – dan gələn rəvayətdə isə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurur: «Allah dörd şeyi əli ilə yaratmışdır. Ərşi, qələmi, Adəmi və Ədn Cənnətini. Sonra digər yaratdıqlarına ol demiş, onlar da olmuşlar» . Kab - *radıyallahu anhu* – deyir ki: "Allah üç şeydən başqasını əli ilə yaratmamışdır. Adəmi əli ilə yaratmış, Tövratı əli ilə yaratmış, Ədn Cənnətindəki (ağacları da) əli ilə əkmişdir və ona danış demiş, o da möminlər qurtulmuşdur – demişdir"[425]. Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Allah Firdousu əli ilə bina etmiş və hər müşrikə, içki içənə və təkəbbürlüyə oranı haram etmişdir"[426].

Allah Qurani Kərimdə bəzi ayələrdə ***Yəduhu*** – bir əl, ***Yədeyyə*** – iki əl, bəzi yerlərdə isə ***Əydinə*** – əllərmizi deyə buyurmuşdu. Çox vaxt iki əza ilə edilən bir işi bir əza ilə edilməsi demək də mümkündür. Məs: Gözümlə gördüm, qulağımla eşitdim və s. Məqsəd isə iki göz və qulaqdır. ***«Oğru kişi və qadının gördükləri işin əvəzi kimi Allahdan cəza olaraq əllərini kəsin».*** *(əl-Maidə 38).* Məqsəd isə iki əldir. ***«Əgər ikiniz də Allaha tövbə etsəniz».*** *(ət-Təhrim 4).* Məqsəd isə ikinizin qəlbidir. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allahın əli elə doludur ki, gecə və gündüz ondan davamlı axar. Siz Allahın göyləri və yeri yaratdıqdan bəri (əliylə) xərclədiyi (verdiyi) şeyləri görmürsünüzmü? Bütün bu verdikləri onun sağ əlindəkiləri heç bir şəkildə əskiltməmişdir» .

***Allahin Hər İki Əli Də Sağdir***: Bu İbn Xuzeymə «ət-Tövhid» 1/159, İmam Əhməd bax: Əbu Yəla «Təbəqatul Hənəbilə» 1/313, Beyhəqi «əl-Əsmə vəs-Sifət» 2/55,56, İbn Teymiyyə «Məcmuul Fətava» 6/397,400, əl-Albani «Məcəllətul Asalə» s 68, «Səhih Hədislər Silsiləsi» 3136 və s. alimlərin görüşüdür. Doğru olan görüşdə elə budur!

---

[422] «Fikhul Əbsat» s. 52,53.
[423] Darakutni «əs-Sifət» s 45, Beyhəqi «əl-Əsmə və əs-Sifət» s 403 Mərfu hədis.
[424] Darimi "Rəddu Alə Cəhmi" 35, Təbəri 21/238, Zəhəbi «əl-Uluv» sənədi ceyyid (yaxşı, gözəl), əl-Albani «Muxtasarul-Uluv» s 105 səhih.
[425] Beyhəqi "əl-Bas vən Nuşur" 213, Həkim 2/392, İbn Əbi Şeybə "Musənnəf" 13/141.
[426] Əbu Nuaym "Sıfət əl-Cənnəh" 1/89, 2/27, Hilyə 3/94-95.
[427] Buxari, Müslim, Əhməd 2/242,Tirmizi 3045, İbn Məcə 197, İbn Xuzeymə «ət-Tövhid» 90, əl-Albani «Səhihul Cəmius Səğir» 8066, «Ziləlul Cənnə» 1/348.

***Allahin İki Əlindən Biri Sağ, Digəri Sol Əldir***: Bu Darimi «ər-Rədd alə Bişril Mərisi» s. 155, Suleyman ət-Təmimi «Kitabut Tövhid» s. 193, Həsən Sıddıq Xan «Katfus Samər» s. 66 və s. alimlərin görüşüdür.

İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şübhəsiz ki, adil olanlar (Qiyamət günü) Rahmənin sağında nurdan minbərlər üzərində olacaqlar. Rahmənin hər iki əli də sağdır. Onlar hökümlərində, ailə haqlarında və əlləri altında olanlarla adil davrananlardır» . İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah ilk olaraq qələmi yaratmış və onu sağ əli ilə tutmuşdur. Onun hər iki əli də sağdır» . İbn Ömər, Ubadə İbn Sabit və İbn Abbas - *radıyallahu anhum* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Heç şübhəsiz ki, Allahın ilk yaratdığı şey qələmdir». Ona: «Yaz!» deyə buyurdu. Qələm: «Ya Rəbbim! Nə yazım» dedi. Allah: «Qiyamətin qopacağı vaxta qədər hər bir şeyin qədərini yaz!» deyə buyurdu[430]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Allah, Adəmi yaradıb ona ruhundan üflədiyi zaman hər iki əli də bağlı olduğu halda Adəmə: «Hansını istəyirsən seç al ey Adəm!» dedi. Adəm də: «Rəbbimin sağ əlini seçdim. Lakin onun hər iki əlidə mübarək sağ əldir» dedi. Daha sonra onu açdıqda içində Adəm və zuriyyəti olduğu və onlardan hər bir insanın ömrünün orada yazılı olduğu ortaya çıxdı .

Əhli Sünnə Vəl Cəmaat Allahın ovcunun olmasına da iman edirlər. Səhih hədislərdə ***Ovuc*** – ləfzi də keçməkdədir. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Elə bir kimsə yoxdur ki, halal bir şeydən sədəqə vermiş olsun və Allah onu sağ əli ilə alıb qəbul etsin. Bu bir xurma olsa da belə. Lakin Allah halaldan başqasını qəbul etməz. Necə ki, sizdən biriniz tayını və ya dəvə balasını böyüdüb yetişdirdiyi kimi sədəqə də Rahmənin ovcunda böyüyüb (çoxalır). Nəhayət dağ kimi vəya dağdan da böyük olur» .

***Həmçinin*** - barmaqlarının olmasına da iman edirlər. Muaz b. Cəbəl - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Rəbbimi (yuxuda) ən gözəl surətdə gördüm və Rəbbimin ovcunu iki çiynimin (kürək sümüyümün) arasına qoyduğunu gördüm. Onun barmaq uclarının (başqa rəvayətdə əllərinin) soyuqluğunu qəlbimdə hiss etdim» . Abdullah b. Amr b. əl-As - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Adəm oğullarının qəlbləri Rahmənin barmaqlarından iki barmağı arasında tək bir qəlb kimidir. Onları istədiyi kimi çevirir» . İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir

---

[428] Müslim 1827, Əhməd 2/160, Nəsai 8/221,222, əl-Albani «Səhihul Cəmius Səğir» 1953, «Məxtəsər Səhih Müslim» 1207.

[429] İbn Əbu Asim «əs-Sünnə» 106, əl-Albani «Səhih Hədislər Silsiləsi» 3136, «Ziləlul Cənnə» 1/49

[430] Əbu Davud 2155,3319, Tirmizi 3319, Musnəd 5/317, İbn Əbi Asim "Sünnə" 102-107, əl-Albani "Ziləlul Cənnə" 1/48-50, "Mişkət" 94, "Səhih Silsilə" 133. Şeyx, mühəddis əl-Albani – *rahmətullahi aleyhi* – nin bu hədis ilə əlaqəli gözəl bir təhrici vardı. Bu təhricdə «Ona yaz dedi» sözünün başında bir «***Fə***» və ya «***Summə - Sonra***» olmasını təhric etmişdir. Buna görə də o, qələmin ərşdən öncə yaranmış olduğunu, ərşin isə yazmadan öncə yradılmış olduğunu təhric etmişdir".

[431] İbn Əbu Asim «əs-Sünnə» 206, İbn Hibban «əl-İhsan» 6167, Beyhəqi «Əsmə və Sifət» 2/56 s. 324, Tirmizi başqa ləfzlə rəvayət edir 3076, əl-Albani «Ziləlil Cənnə» 1/91.

[432] Buxari 1410, Müslim 1014, Əhməd 2/331,418, Tirmizi 661,662, Nəsai 5/56,58, İbn Məcə 1842, əl-Albani «İrvalul Ğəlil» 3/393,395, 886, «Mişkətul Məsabih» təhqiqi 1/431,432, «Səhihul Cəmius Səğir» 5600, 6152.

[433] İmam Əhməd 5/243, Tirmizi 3235, İbn Əbu Asim «əs-Sünnə» 465,471, əl-Albani «Ziləlul Cənnə» 1/203,205.

[434] Müslim 2654, Əhməd 2/168,173, Tirmizi 2140, İbn Məcə 3834, əl-Albani «Səhih Hədislər Silsiləsi» 1689, "Ziləlul Cənnə" 1/100,103,222, "Mişkət" 89,102, "Sahih Cəmius Sağir" 1685. Lakin bu o, deməк deyil ki, Adəm övladının qəlbləri Allahın barmaqları ilə təmas edib (bitişib).

ki, bir Yəhudi Rəsulullah – *sallallahu aleyhi və səlləm* – ə dedi: «Ey Muhəmməd (Başqa rəvayətdə: Ey Əbul Qasım!) Şübhəsiz ki, Allah Qiyamət günü göyləri bir barmağına, yeddi qat yeri bir barmağına, dağları bir barmağına, ağacları bir barmağına və yaratdıqlarını bir barmağına alıb buyuracaq: «Bu gün Məlik mənəm». Bu sözlərdən sonra Rəsulullah – *sallallahu aleyhi və səlləm* – qabaq dişləri görünəcək şəkildə gülümsəmiş və: ***«Allahı lazımınca qiymətləndir-məyənlər. Halbuki Qiyamət günü yer bütünlüklə onun ovcunun içində olacaq, göylər isə onun sağ əli ilə büküləcəkdir».*** *(əz-Zumər 67).* Ayəsini oxudu . Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah Qiyamət günü yeri ovcunun içinə alır, göyü isə sağ əlinə alıb buyuracaqdır: Mənəm hökmdar, bəs yerin hökmdarları haradadır?» . İbn Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Allah Qiyamət günü bütün göyləri bükər. Sonra onları sağ əli ilə tutar. Məlik mənəm, zalımlar haradadır? Təkəbbürlülər haradadır? Deyə buyurar. Sonra sol əliylə göyləri bükər. Sonra: Məlik mənəm, zalımlar, təkəbbürlülər haradadır?» deyə buyurar[437]. Əbu Musa əl-Əşari - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah əllərini gecə açır ki, gündüz günahkarı tövbə etsin, gündüz əllərini açır ki, gecə günahkarı tövbə etsin. Bu da günəşin batdığı yerdən doğuncaya qədər davam edər» .

## ALLAH - *Subhənəhu Və Təalə* – nin İTYAN – GƏLİŞ, MƏCİ – GƏLMƏK SİFƏT

***«Yoxsa onlar Allahın bulud kölgələri içində mələklərlə gəlməsini və işin tamam olmasını gözləyirlər».*** *(əl-Bəqərə 210).* ***«****(Məkkə müşrikləri)* ***özlərinə mələklərin, yoxsa Rəbbinin, yaxud da Rəbbinin bəzi qiyamət əlamətlərinin gəlməsinimi gözləyirlər».*** *(əl-Ənam 158).* ***«Sənin Rəbbin gələndə mələklər səf-səf durarlar».*** *(əl-Fəcr 22).*

Müxaliflər bu ayələri əzabın gəlməsi, mələklərin gəlməsi kimi qeyd edirlər. Bu cür təvilə yer yoxdur. Çünki biz bilirik ki, mələklər yalnız Allahın əmri ilə enirlər. ***«Biz dünyaya yalnız sənin Rəbbinin əmri ilə enirik».*** *(Məryəm 64).* Həmçinin ayədən də açıq-aydın görünür ki, mələklər və Rəbbin gəlişi eynidir. Mələklərin səf-səf durması isə təzim etmək məqsədilədir. Hökm vermək üçün isə Allah Qiyamət günü gələcəkdir. Bütün bunlar Allahın felləridir və onlar heç bir yaradılışın enməsinə, qalxmasına, yüksəlməsinə bənzəməz. ***«Ona bənzər heç bir şey yoxdur».*** *(əş-Şura 11).*

## ALLAH - *Subhənəhu Və Təalə* - nin NÜZUL – ENMƏ SİFƏTİ

əz-Zəhəbi – *rahmətullahi aleyhi* – deyir ki: «Allahın Nüzul sifətinə aid olan hədislərin hamısı mutəvatirdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən **28-**

---

[435] Buxari 4811,7414,7451,7513, Müslim 2786,2788,4992, Əhməd 1/457, Tirmizi 3238, əl-Albani «Ziləlul Cənnə» 1/238,240, «Mişkətul Məsabih» 5524.
[436] Buxari 4812,6519,7382,7413, Müslim 2787,4994, Əhməd 2/374, İbn Məcə 192, Darimi 2799, əl-Albani «Ziləlul Cənnə» 1/241,242, "Mişkət" 5522, «Səhih Cəmius Səğir» 8125.
[437] Müslim 4995.
[438] Müslim.

səhabənin rəvayət etdiyi bu hədisi Əhli Sünnə ittifaq ilə qəbul etmişlər[439]. Buna görə də inkar və rədd edilməsinə yer yoxdur. Allahın Nüzul etməsi, İstivası kimi yaradılışların istivasına bənzəmədiyi kimi, yaradılışların nüzuluna da bənzəməz»[440]. Allahın dünya səmasına enməsi Onun diləməsinə və hikmətinə bağlı feli sifətlərindən olub ucalığına və böyüklüyünə yaraşır həqiqi bir enməkdir. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Rəbbimiz hər gecənin ***1/3***-də dünya səmasına enir və buyurur: Mənə dua edənin duasını qəbul edərəm, məndən istəyənin istədiyini verərəm, bağışlanma diləyəni bağışlayaram»[441]. Allahın Nüzul - enmə sifətini Allahın əmrinin, rəhmətinin enməsi kimi təhrif edeənlər çox böyük xətaya yol vermişlər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – enməyi Allaha izafə etmişdir. Enməni başqasına nisbət etmək açıq mənaya olan təhrifdir. Əgər bundan məqasəd: Xüsusi bir əmr və xüsusi bir rəhmətdir ki, hər zaman olması mümkün deyildir deyilərsə - bu zaman cavabımız: Əgər bu təvil doğru olarsa belə hədis əmr və rəhmətin endiyi ən son nöqtə dünya səması olduğunu göstərir. O, halda bu xüsusi rəhmətin dünya səmasına enməsinin bizim üçün nə xeyiri vardır ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bunu bizə xəbər versin?". Hədis dünya səmasına enənin: Mənə dua edənin duasını qəbul edim, Məndən istəyənin istədiyini verim, Bağışlanma diləyəni bağışlayım – dediyini göstərir. Allahdan qeyrisi bunu söyləyə bilməz. Çünki Allahın əmrinin, rəhmətinin enməsi gecənin ***1/3***- xas olan bir şey deyildir. Tərsinə Allahın əmri və rəhməti hər zaman enər. Fudeyl İbn İyad – *rahmətullahi aleyhi* – deyir ki: "Cəhmilərdən biri sənə: Mən (gecənin ***1/3*** dünya səmasına enən) Rəbbə iman etmirəm (Belə Allahı mən qəbul etmirəm)" deyərsə ona: Mən istədiyini edən Rəbbimə iman etdim" deyə cavab ver[442]. İmam Əbu Hənifə – *rahmətullahi aleyhi* – ın Allahın (gecənin ***1/3*** dünya səmasına enməsi) barədə soruşurlar o: "O, Necə? – sualı olmadan (dünya səmasına) nazil olur"[443]. İmam Şafii – *rahmətullahi aleyhi* – deyir ki: "Sünnə barədə mənim sözüm – hansı ki, bir çox (alimlər) bunun üzərində idilər: Sufyan əs-Souri, İmam Məlik və s. ki, Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına və Muhəmmədin Onun Rəsulu olduğuna, Allahın Ərşin üzərində olduğuna, yaratdıqlarına istədiyi kimi yaxınlaşan və dünya səmasına istədiyi kimi nazil olandır"[444]. İmam Əhməd – *rahmətullahi aleyhi* – deyildi ki: "Allah yeddi səma üzərində, Ərşin üzərinə istiva etmişdir. Yaratdıqlarından ayrıdır, lakin elimi və qüvvəsi hər yerdədir". İmam: "Bəli, O, Ərşi üzərindədir və Onun elimindən heç nə gizli deyildir"[445]. İmam Əhməd – *rahmətullahi aleyhi* –: ***"O, sizinlə bərabərdir"*** ayəsi barədə soruşdular. İmam: "Bu hər bir şeyi əhatə edən Onun elmidir, Rəbbimiz isə Ərşin üzərinə (İstiva) etmişdir..."[446].

---

[439] 28 Səhabədən gələn ***Mutəvatir*** hədisdir. Bir çox alim buna işarə etmişdir: İbn AbdulBərr "Təhmid" 7/128, Darkutni "Kitabul Nuzul", İbn Teymiyyə "Məcmuul Fətava" 5/322, Zəhəbi "Uluv" s. 73,79, əl-Albani "İrva" 450, "Şərh Əqidətul Təhaviyyə" s. 222,245, "Ziləlil Cənnə" 1/216-222.

[440] əz-Zəhəbi «əl-Uluvv il-Aliyyul Ğaffar» s.73,79.

[441] Buxari 1145, Müslim 168, 758, Əbu Davud 1315,4733, Tirmizi 446,3498, İbn Məcə 1366, Darimi 1478, Əhməd "Sünnə" 153, Ləlakai 745, Zəhəbi "Uluv" 78, əl-Albani "Ziləlul Cənnə" 492-503, "İrva" 450, "Səhih" 8165, Mişkət "1223.

[442] Buxari "Xalqu Afalul İbad" səh 36.

[443] Sabuni "Əqidətus Sələf" s. 42,59, Beyhəqi "Əsmə" s. 456,572, 2/200, Aliyyul Kari "Fikhul Əkbər" s. 38,60, əl-Albani "Şərh Əqidətul Təhaviyyə" s. 223.

[444] Zəhəbi "Uluv" 443, İbn Qudamə "Lumatul Etiqad".

[445] Həlləl "Sünnə", Zəhəbi "Uluv" 176.

[446] Ləlakai "Usulu Etiqad" 3/402, "Muxtəsər Uluv" 190.

Sələflər deyirlər ki, müxaliflərdən biri sənə: «Allah dünya səmasına necə enir?» deyə soruşsa ona belə cavab ver: «Allah bizə enməsini bildirmişdir, fəqət necə endiyini bildirməmişdir».

## ALLAH - *Subhənəhu Və Təalə* - nin ÜZ – SİFƏTİ

Əhli Sünnə Vəl Cəmaat Allahın üzünün olduğuna da inanırlar. Allahın – *subhənəhu və təalə* - üzü, Onun sabit zatı sifətlərindən olub ona yaraşır həqiqi bir üzdür. Müxaliflər Allahın üz sifətini Allahın savabı kimi təhrif edirlər. Savab yaradılmışdır və Allahdan ayrıdır, Üz isə Allahın sifətlərindən olub yaradılmamışdır və Ondan ayrı deyildir. Elə isə necə ola bilər ki, üz savab mənasında təfsir edilsin. Əbu Hənifə – *rahmətullahi aleyhi* – deyir: «Onun əli, üzü və nəfsi vardır. Allahın kitabında bildirdiyi üz, əl, nəfs onun keyfiyyəti bilinməyən sifətlərindəndir . ***«Ancaq əzəmət və kərəm sahibi olan Rəbbinin üzü qalar».*** *(ər-Rahmən 27).* ***«Onun simasından başqa hər şey məhvə məhkumdur».*** *(əl-Qəsəs 88).* ***«Allahın üzünə*** *(rizasını diliyərək)* ***zəkat verənlərin*** *(mükafatı)* ***qat-qat artacaqdır».*** *(ər-Rum 39).* Əli - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – mənə buyurdu: Yatağına girəndə bu sözləri de: «Nazil etdiyin şərdən qorunmaq üçün sənin kəramətli üzündən və kamil kəlamlarından kömək diləyirəm» . Əbu Musa - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah yatmır. Ona yatmaq yaraşmaz. Mizanı (Başqa rəvayətdə: Ədaləti) endirsin və ya qaldırsın. Gündüzün əməlindən əvvəl gecənin əməli, gecənin əməlindən əvvəl gündüzün əməli ona (Allaha) yüksəlir (qaldırılır) Onun örtüyü (pərdəsi, hicabı) nurdur. (Əbu Bəkr - *radıyallahu anhu* – nun rəvayətində pərdəsi atəşdir). Əgər üzündəki pərdəni qaldırsa üzünün nurları yaratdığı hər bir şeyi yandırar . Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «(Allahım!) Səndən, üzünə baxmaq ləzzətini və Səninlə qarşılaşma arzusunu mənə lütf etməni diləyirəm» . Heç bir üz ona bənzəmədiyi kimi, onun üzü də heç bir üzə bənzəməz.

## ALLAH - *Subhənəhu Və Təalə* - nin GÖZ – SİFƏTİ

Əhli Sünnə Vəl Cəmaat Allahın, Kitab və Sünnə ilə sabit zatı sifətlərindən olan iki gözü olduğuna da iman edirlər. ***«….Gəmi gözümüzün qabağında*** *(nəzarətimiz altında)* ***üzüb gedirdi».*** *(əl-Qəmər 14).* Ənəs İbn Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Elə bir Peyğəmbər yoxdur ki, ümmətini yalançı, bir gözü kor Dəccəldən çəkindirməsin. Diqqət edin. Dəccəlin bir gözü kordur . Sizin Rəbbiniz isə tək göz deyildir» . Əbu Rəzin əl-Ukaylı - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu:

---

[447] «Fiqhul Əkbər» s. 59,302.
[448] Beyhəqi «Əsmə və Sifət» 1/307.
[449] Müslim 179/293, İmam Əhməd 4/395,401, İbn Məcə 195, Darimi «ər-Rədd aləl Mərisi» s. 173, Beyhəqi «Əsmə və Sifət» s. 402, əl-Albani «Muhtasarul Uluvv» s. 86, «Səhih Cəmius Səğir» 1860.
[450] Əhməd 5/191, Həkim 1900, Təbərani «Məcmul Kəbir» 4803,4932, əl-Albani «Səhihut Tərğib» 1/346, «Ziləlul Cənnə» 1/185. Ammar İbn Yəsir - *radıyallahu anhu* – yolu ilə: Əhməd 4/264, Nəsəi 3/54-55, İbn Əbi Asim "Sünnə" 424,425, əl-Albani "Kəlimətu Tayyib" 105, "Səhih Sünən Nəsəi" 1/281, "Ziləlil Cənnə".
[451] Hədislərdə Dəccəlin sağ gözünün kor olduğu haqqında məlumatlar vardır. Lakin sol gözünün kor olması haqında da hədislər vardır. Sağ gözünün kor olduğu haqqında olan hədislər sənəd baxımından daha sağlamdır.
[452] Buxari 7131,7408, Müslim 2933, Tirmizi 2245, Əbu Davud 4316, əl-Albani "Səhih Cəmius Sağir" 3402,5578,5789, "Şərh Əqidətul Təhaviyyə" s. 500.

«(Rəbbimiz) daralmış, ümüdsiz düşmüş halınıza baxar» . ***«…Gözümün qabağında boya-başa çatdırılasan deyə, öz tərəfimdən sənə bir sevgi yaratdım».*** *(Ta ha 39).* ***«O Allah ki, səni namaza duranda da görür, səcdə edənlər içində olanda da».*** *(əş-Şuəra 218-219).* Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qul namaza durduğu zaman Rəhmanın iki gözü önündə durur» .

## ALLAH - *Subhənəhu Və Təalə* - nin RİCL VƏ QADƏM - AYAQ SİFƏTİ

Əhli Sünnə Vəl Cəmaat Allahın Ricl və Qadəm ayaq sifətinin olmasına da iman edirlər. ***«O, gün Cəhənnəmə doldunmu?» deyərik. O: «daha varmı?» deyər».*** *(Qaf 30).* Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «….Allah Cənnətə sən mənim rəhmətimsən, mən səninlə qullarımdan istədiyimə rəhmət edirəm». Cəhənnəmə də: «Sən mənim əzabımsan. Mən səninlə qullarımdan istədiyimə əzab edirəm. Hər birinizə dolusu qədər var. Amma Cəhənnəm dolmaq bilməz. Nəhayət Allah ayağını onun üzərinə qoyar, o da: Bəsdi, Bəsdi! Deyib Cəhənnəm dolar. (Cəhənnəmi doldurmaqla) Allah heç bir kəsə zülm etməz. Cənnətə gəlincə Allah onun boşluqlarını doldurmaq üçün bir neçə varlılıqlar yaradır» .

Allahın Cəhənnəm atəşinə ayağını qoymaqda hikmətə gəlincə: ***«Mən Cəhənnəmi bütün cinlər və insanlarla dolduracağam» – sözü təmamilə yerinə yetdi.*** *(Hud 119)* buyurduğu kimi oranı dolduracağını vəd etmişdi. Günahsız kimsələrə əzab etməməsi onun rəhməti və ədalətindəndir. Cəhənnəm son dərəcə geniş və dərin olduğundan Allah vədini gerçəkləşdirmək üçün ayağını qoyacaq, bu vaxt Cəhənnəm hər iki tərəfdən bir-birinə qovuşmuş olacaqdır. Cənnətdə isə Allah hər bir insana geniş yer verəcəkdir, lakin boş yerlər qaldıqda Allah yeni varlılıqlar yaradacaqdır. ***«O, gün ayaq ortaya çıxarılır».*** *(Nun 13, 42).* Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Rəbbimiz (qiyamət günü) ayağını ortaya çıxarır (göstərir) və bütün mömin kişi və qadınlar onun qarşısında səcdəyə qapanırlar. (Yalnız) dünyada ikən göstəriş və riyakarlıqla səcdə edənlər qalırlar. (Onlardan hər biri) səcdə etməyə çalışarlar. Lakin onların onurğa sümükləri tək bir sümük halına düşər (əyilməz) və (onlar səcdə edə bilməzlər)» .

## ALLAH - *Subhənəhu Və Təalə* – nin MƏKR VƏ KEYD (HİYLƏYƏ QARŞILIQ VERMƏK) SİFƏTİ

***«Onlar*** *(İsaya inanmayanlar)* ***hiyləyə əl atdılar. Allah da onların hiyləsinə qarşı əvəz verdi. Allah bütün hiyləgərlərdən tədbirlidir*** *(hiyləgərlərə ən yaxşı cəza verəndir)».* *(Ali İmran 54).* ***Həqiqətən*** *(Məkkə müşrikləri Quranın nurunu söndürmək üçün)* ***hiylə qurdular. Mən də*** *(hiylələrinə qarşı)* ***onlara cəza verirəm».*** *(ət-Tariq*

---

[453] Həsən hədis. Əhməd 4/12, İbn Məcə 181, Darakutni «əs-Sifət» 30, Beyhəqi «Əsmə və Sifət» 2/221, İbn Huzeymə "Tovhid" s. 122-125,153, əl-Albani «Səhih Hədislər Silsiləsi» 6/2/736,2810, «Əqidətul Vasitiyyə» Useyminin şərhi ilə 2/26.
[454] Çox zəif hədis. əl-Albani «Zəif Hədislər Silsiləsi» 1024, «Daifut Tərğib» 289.
[455] Buxari, Müslim.
[456] Buxari 4919.

*15,16).* ***Onlar bir hiylə qurdular. Biz isə özləri də bilmədən*** *(gözlənilməyən bir əzabla)* ***hiylələrinin cəzasını verdik».*** *(ən-Nəml 50).*

Sələflərdən bəziləri Allahın qullarına olan Məkrini (yəni hiyləyə qarşılıq verməsini) onların bilmədikləri bir yerdən nemətlər ilə dərəcə-dərəcə əzaba yaxınlaşdırılması diyə açıqlamışlar. Onlar yeni bir günah etdikdə O, da onlara yeni bir nemət ehsan edər. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Bir kimsə günah etməyə davam etdiyi müddətdə və Allahın ona dünyadan sevdiyi şeyləri verdiyini görəcək olsan bil ki, bu Allah tərəfindən (o, kimsəyə) dərəcə-dərəcə əzaba yaxınlaşdırılmasıdır. ***«Kafirlərə edilmiş xəbərdarlığı unutduqları zaman*** *(küfürlərini daha da artırmaq məqsədilə)* ***hər şeyin*** *(bütün nemətlərin)* ***qapıların onların üzünə açdıq. Kafirlər özlərinə verilən*** *(dünya)* ***nemətlərinə sevindikləri vaxt onları qəflətən yaxaladıq və onlar*** *(hər şeydən)* ***məhrum oldular».*** *(əl-Ənam 44)* . Allah hiyləyə qarşılıq verənlərin ən xeyirlisidir.

***«Onlar*** *(İsaya inanmayanlar)* ***hiyləyə əl atdılar. Allah da onların hiyləsinə qarşı əvəz verdi. Allah bütün hiyləgərlərdən tədbirlidir*** *(hiyləgərlərə ən yaxşı cəza verəndir)».* *(Ali İmran 54).* Bu ayə Yəhudilərin İsa – *əleyhissəlam* – ı öldürmək istədikləri üzərinə nazil olmuşdur. Xain Yahuza adında biri İsa – *əleyhissəlam* – ı öldürmək üçün onu təqib edənlərlə birlikdə (İsa – *əleyhissəlam* – ın) olduğu yerə gəlir. Lakin Allah, İsa – *əleyhissəlam* – ı səmaya yüksəldir. Xain Yahuzanı isə İsa – *əleyhissəlam* – a bənzədir. Xain Yahuza evi axtarıb İsa – *əleyhissəlam* – ı orada tapmadıqda çölə çıxır. Onunla gələnlər Yahuzanın İsa olduğunu görüb bu inancla onu öldürürlər .

## ALLAH - *Subhənəhu Və Təalə* – nin SEVİNMƏK VƏ GÜLMƏK SİFƏTİ

Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və salləm* – buyurdu: «Allah hər ikisi də Cənnətə düşən və biri digərini öldürmüş iki nəfərin halına gülər. Səhabələr: «Bu necə ola bilər Ya Rəsulullah!» deyə soruşdular. Peyğəmbər: «Onlardan biri Allah yolunda vuruşaraq (digəri tərfindən) öldürüləək şəhid olur və (Cənnətə düşür). Lakin sonra Allah onu öldürənə tövbə və hidayət nəsib edir. O, da Allah yolunda vurşur və şəhid olur» deyə buyurdu .

«Uca Allah - Gülər» hədisi ilə əlaqədar olaraq Əhli Sünnə Vəl Cəmaat bu hədisin və başqalarının ifadə etdiyi şəkildə – Uca Allah haqqında Onun zatına yaraşır bir şəkildə gülmək xüsusiyyətini qəbul etməkdədirlər. Onun gülməsi nə zatında, nə səbəblərində, nə də başqa bir xüsuslarda yaratdıqlarından heç birisinin gülməsinə bənzəməz. ***«Ona bənzər heç bir şey yoxdur».*** *(əş-Şura 11).* Bu da Uca Allahın rəhmətinin kamilliyi, qullarına ehsan və lütfünün genişliyindəndir. Müsəlman Allah yolunda savaşır, kafir tərəfindən öldürülürsə, müsülman kimsə şəhit olmaq lütfünə nail olur. Daha sonra Uca Allah o, müsülmanı öldürənə rəhm edir, onu İslama yönəldir və ona da Allah yolunda şəhit olmağı nəsib edir. Beləcə hər iksi də Cənnətə düşürlər.

Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «…Allah öz qulları üzərində haqq-hesabı çəkib bitirdikdən sonra Cənnət ilə Cəhənnəm arasında bir nəfər qalır. Bu kimsə Cənnətə girən ən son

---

457 İmam Əhməd «Musnəd» 4/145, əl-Albani «Səhih Silsilələr» 413.
458 İbn Kəsr 11/37 heç bir qaynaq zikr etmədən göstərir.
459 Buxari, Müslim.

Cəhənnəmlik olacaqdır. (Başqa rəvayətdə: «Bu kimsə Cənnət əhlinin Cənnətə ən son girəni olacaqdır»). Onun üzü Cəhənnəmə tərəf yönəlmiş olacaqdır. O, kimsə: «Ya Rəbbim! Üzümü Cəhənnəmdən çevir onun isti küləyi (qoxusu) məni zəhərləyib öldürür, atəşi isə məni yandırır». Allah: «Əgər sənin istədiyin yerinə yetsə bundan sonra məndən başqa bir şey istəyəcəksənmi?» deyə buyurur. O, kimsə: «İzzətinə and olsun ki, xeyr!» deyərək Allaha (bu işdə) and və söz verir. Allah onun üzünü Cəhənnəm atəşindən çevirir. O, kimsə üzünü Cənnətə tərəf çevirdikdə oranın gözəlliyini görüb Allahın dilədiyi müddət qədər susduqdan sonra: «Ey Rəbbim! Məni Cənnətin qapısına yaxınlaşdır» deyir. Allah: «Məgər sən and içməmişdin ki, Məndən bu istədiyindən başqa bir şey istəməyəcəksən?». O, kimsə: «Ey Rəbbim! Yaratdıqlarının ən bədbəxti olmamaqdan ötrü!» deyir. Allah: «Əgər sənin bu istədiyin də yerinə yetsə bundan sonra məndən başqa bir şey istəyəcəksənmi?» deyə buyurur. O, kimsə: «İzzətinə and olsun ki, xeyr!» deyərək Allaha (bu işdə) and və söz verir. Allah onu Cənnətin qapısına yaxınlaşdırır. O, kimsə Cənnətin qapısına yaxınlaşdıqda orada olan gözəlliyi, içindəki sevinci və rəngarəngliyi gördükdə Allahın dilədiyi müddət qədər susduqdan sonra: «Ey Rəbbim! Məni Cənnətə sal!» deyir. Allah: «Vay sənə ey Adəm oğlu! Nə qədər sən öz sözündən dönürsən! Məgər sən and içməmişdin ki, Məndən bu istədiyindən başqa bir şey istəməyəcəksən?». O, kimsə: «Ey Rəbbim! Məni yaratdıqlarının ən bədbəxti etmə!» deyəcəkdir. Allah gülər və ona Cənnətə girməyə izn verər və ona: «Dilədiyini istə!» buyurar. O, da arzuladığı şeyləri tükənənə qədər istəyəcəkdir. Arzuladığı şeylər tükəndikdən sonra Allah: «Bunu da, bunu da (əlavə et) buyuraraq ona istədiklərini xatırladacaqdır. Sonda bütün istədikləri bitdikdən sonra Allah: «Bunların hamısı və bir o, qədər də sənindir!» deyə buyurur . Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah qulunun tövbə etməsi ilə sizdən hər hansı birinizin bu halından daha çox sevinir». Bir kimsə otsuz boş bir quru ərazidə dəvəsi ilə gedirdi. Dəvənin üzərində də o, kimsənin yeyəcək və içəcək şeyləri də vardır. (Başqa rəvayətdə: «Çöllük bir əraziyə çatdıqda ona şirin bir yuxu gəldi. Dəvəsi üzərindən enərək bir ağac tapıb altında mürgüləmək üçün uzandı). Oyandıqda bir də baxdı ki, dəvəsi yeyəcək və içəcək şeylərlə birlikdə yoxdur. Dəvəsini axtarmaq üçün oyana-buyana qaçır. Nəhayət dəvəsini axtarıb tapmaqdan ümüdünü kəsdikdə yatdığı yerə qayıdaraq: «Artıq buradan ölənə qədər ayrılmayacağam!» deyib yan tərəfi üstə uzanaraq yatdı. (Ayıldıqda) Bir də baxdı ki, dəvəsi başı üzərində dayanıb. Dəvəsinin ipindən tutaraq sevincinin şiddətindən: «***Allahummə Ənnə Abdi Və Ənə Rabbukə*** – Allahım Sən mənim qulumsan, mən də Sənin Rəbbinəm!» deyə şükr edir. «Sizdən hər hansı biriniz (itmiş dəvəsini) üzərində yemək və içəcəyi ilə birlikdə tapmasından daha çox, Uca Allah tövbə etmiş mömin qulunun tövbəsindən ötrü sevinir» .

Bu hədisdə Uca Allaha xas olan sevinmək sifətindən söz açılmışdır. Buna dair söylənilləcək sözlər də digər sifətlər haqqında söylənilləcək sözlər kimidir. Bu sifət Uca Allaha yaraşır şəkildə onun feli sifətlərindəndir. Burada «sevinmək» deyə ifadə edilən bu məna qulun tövbə edib, Allaha doğru döndüyü təqdirdə meydana gəlir. Bu eyni zamanda Allahın tövbə edən quldan razı olmasını və tövbəsinin qəbul etməsini də əhatə edir. Lakin bir şeyi yadda saxlamalıyıq ki, Allahın yaratmış olduğu qulların sevinməsi müəyyən şəkillərdə olur. Kimi zaman hansısa bir xoş sözdən, xoş hadisədən

---

[460] Buxari, Müslim.
[461] Buxari, Müslim.

və s. baş verir. Lakin Uca Allah bütün bunlardan münəzzəhdir. Onun sevinməsinin nə zatında, nə səbəblərində, nə də başqa bir xüsuslarda yaratdıqlarından heç birisinin sevinməsinə bənzəməz.

Quran və Sünnə ilə bizə məlum olan sevinmək, gülmək və s. kimi Allaha xas olan sifətləri bəzi azmışlar (müxaliflər) nəfi və tətil etməkdədirlər. Bu azmışların Rəbləri haqqında olan pis zənnləridir ki, onları bu nöqtəyə gətirib çıxarmışdır. Çünki onlar bu kimi sifətlərin məxluqatda da olduğunu bilib, Allaha aid olan bu sifətləri nəfi və tətil etmişlər. Lakin Uca Allah onların bu bənzətmələrindən də və tətillərindən də uca və münəzzəhdir. ***«Ona bənzər heç bir şey yoxdur».*** *(əş-Şura 11).* ***«Allah*** *(müşriklərin)* ***ona aid etdikləri sifətlərdən tamamilə uzaqdır».*** *(əs-Saffət 159).*

## ALLAH - *Subhənəhu Və Təalə* – nin TƏƏCCÜBLƏNMƏK – HEYRƏT ETMƏK SİFƏTİ

***«Bəli sən onlara*** *(müşriklərin Allahın qüdrət əlamətlərini gördükləri halda qiyamətə inanmamalarına)* ***təəccüblənirsən, onlar isə*** *(sənin bu imanına)* ***istehza edirlər».*** *(əs-Saffət 12).*

Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah zəncirlərlə Cənnətə girəcək bir topluluğun halına təəccüb (heyrət) edər»  . Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah filan kişi ilə filan qadından dolayı təəccüb (heyrət) edər»  . Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, bir gün bir nəfər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına (aclıqdan üzülmüş və əldən düşmüş) bir halda gəlir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – zövcələrinə (yeməyə bir şeyin olub-olmaması haqında) xəbər göndərir. Lakin onların hər biri: «Sudan başqa heç bir şey yoxdur!» deyə xəbər göndərirlər. Bundan sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizlərdən kim bu kimsəni (qonaq) müsafir olaraq evinə dəvət edər?». Ənsarlardan biri (Əbu Təlhə): «Mən!» deyə cavab verdi. Müsafiri (qonaqı) götürüb (evə) zövcəsinin yanına gəldi və: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in qonağına hörmət et!» dedi. Zövcəsi: «Bizdə uşaqlar üçün hazırladığım yeməkdən başqa bir şey yoxdur» deyə cavab verdi. Onda o: «(Axşam) yeməyini hazırla, lampanı da yandır. Əgər uşaqlar yemək istəsələr onların (başlarını qatıb) yatızdır» dedi. Zövcəsi ərinin dediyi kimi etdi. (Axşam) Yeməyini hazırladı, lampanı yandırdı və uşaqları da yatağına göndərdi». (Qonaqlarla birlikdə stol başına əyləşdikdən sonra) yerindən qalxaraq lampanı düzəldirmiş kimi onu söndürür. Ər-arvad qonaq ilə bərabər yeməkdən yeyirmiş kimi (əllərini qaba uzadıb, lakin boş geri qaytarırdılar. Qonaq isə özü bütün yeməyi yeyib qurtarır). Sonunda onlar (ər-arvad) ac olaraq sabahlayırlar. Səhəri ev sahibi Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəlir. Peyğəmbər: «Allah sizin bu əməlinizə təəcub (heyrət) edir!» deyə buyurdu. Sonra Allah bu ayələri nazil etdi: ***«Mühacirlərdən əvvəl*** *(Mədinədə)* ***yurd salmış və*** *(Peyğəmbərə qəlbən)* ***iman gətirmiş kimsələr*** *(ənsar)* ***öz yanlarına*** *(şəhərlərinə)* ***mühacirət edənləri sevər, onlara verilən qənimətə görə ürəklərində həsəd, qəzəb duymaz, özləri ehtiyac içində olsalar belə, onları özlərindən üstün***

---

[462] Buxari.

[463] Buxari.

***tutarlar.*** *(Allah tərəfindən)* ***nəfsinin xəsisliyindən, tamahından qorunub saxlanılan kimsələr – məhz onlar nicat tapıb səadətə*** *(Cənnətə)* ***qovuşanlardır!».*** *(əl-Həşr 9)* .

## ALLAH - *Subhənəhu Və Təalə* – nin QISQANMAQ SİFƏTİ

Rəvayət edilir ki, bir gün Sad b. Ubadə - *radıyallahu anhu* – qışqıraraq: «Əgər mən yad bir kişini öz arvadımla görsəydim onu qılıncla doğrayardım (vurardım)». (Bunu eşidən) Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – səhabələrə: «Sadın qısqanclığı sizi təəcübləndirirmi? Həqiqətən mən ondan da qısqancam, Allah isə məndən də qısqancdır» deyə buyurdu. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şübhə yox ki, Allah qısqanır. Allahın qısqanması mömin bir qulun Allahın haram (qadağan) etdiyi şeyləri etməsi ilədir» . İbn Məsud – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allahdan daha qısqanc bir kəs yoxdur. Allah bu qısqanclığına görə açıq və gizli olan bütün çirkin əməlləri haram etmişdir. Təriflənməyi Allahdan daha çox sevən bir kimsə yoxdur. Buna görə Uca Allah Öz nəfsini tərifləmişdir. Allahdan daha çox dəlil sevən yoxdur. Bax, bunun üçün də bir çox müjdələyən və qorxudan Peyğəmbərlər göndərmişdir (Başqa rəvayətdə: Bax buna görə də Allah peyğəmbərlərini göndərmiş və kitablarını endirmişdir) .

## ALLAH - *Subhənəhu Və Təalə* – nin QƏZƏBLƏNMƏK SİFƏTİ

Allah - *subhənəhu və təalə* – qəzəblənirmi? Uca Allahın kitabını səhifə-səhifə çevirmiş olsaq bu sualın cavabını tapmış olarıq. Allah buyurur: ***«Onun barəsində bədgüman, bədniyyət olan münafiq kişi və qadınları, müşrik kişi və qadınları əzaba düçar etsin. Onların bədniyyətliyi öz başlarında çatlasın! Allahın onlara qəzəbi tutmuş və Allah onlara lənət etmişdir. Allah Cəhənnəmi onlar üçün hazırlamışdır. Ora necə də pis məskəndir».*** *(əl-Fəth 6).* ***«Ey iman gətirənlər! Allahın qəzəbinə düçar olmuş bir qövmlə dostluq etməyin».*** *(əl-Mumtəhinə 13).* ***«Sizə verdiyimiz ruzilərin təmizindən*** *(halalından)* ***yeyin, lakin bunda həddi aşmayın.****(israfçılıq, xəsislik və nankorluq etməyin, ehtiyacı olana şəri qayda üzrə kömək göstərin),* ***yoxsa qəzəbimə düçar olarsınız».*** *(Ta ha 81).* Həmçinin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sünnəsində varid olmuş səhih hədisdə insanlar qorxaraq şəfaət üçün Peyğəmbərlərin yanına gedəcəklər, hər bir Peyğəmbər isə: «Şübhəsiz ki, Rəbbimiz bu gün bərk qəzəblənmişdir. O, dərəcədə ki, nə bundan qabaq belə bir qəzəb etmişdir, nə də bundan sonra belə bir qəzəb edəcəkdir» . Əbu Hənifə – *rahmətullahi aleyhi* – deyir ki: «O, (Allah) qəzəb də edər. Razı da olur. Onun qəzəbi cəzalandırması, rizası da mükafatlandırması kimi deyilməz» .

O, halda müsəlmanın üzərinə düşən Rəbbinin bu sifətə sahib olduğunu qəbul etmək onu müxaliflərin təvil etdikləri kimi təvil etməməkdir . Allah və Rəsulunun və bu

[464] Buxari.
[465] Buxari 5223.
[466] Buxari 7416, Müslim 1499.
[467] Buxari, Müslim.
[468] Fikhul Əbsat s. 56.
[469] ***Əşarilər*** **–** Allahın Qəzəb sifətini ***Ukubət*** (cəzalandırmaq) kimi təvil edirlər.

ümmətin sələfinin Allahın sifətləri xüsusunda izlədikləri yol budur. Müsəlmana da bu xüsusda onların yolunu izləmək düşər. Çünkü qurtuluş bu yoldadır.

## İSİM VƏ SİFƏTLƏR TÖVHİDİNƏ ZİDD OLAN ETİQADLAR (SÖZ VƏ ƏMƏLLƏR)

**1.** Allah - *subhənəhu və təalə* - nin isimlərini bütlərə qoymaq. Məs: Allahın ***əl-İlah*** adını, ***əl-Lat*** adı ilə dəyişərək öz bütlərinə qoymuşlar. ***əl-Lat –*** Taif şəhərində ağ dağın adı idi. Sukayf qəbiləsindən olanlar bu bütləri ilə fəxr edirdilər. İbn Hişam – *rahmətullahi aleyhi* – deyir: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in əmri ilə Muğirə b. Şöbə və Əbu Sufyan b. Hərb - *radıyallahu anhum* – onu yandırıb dağıdırlar. Sonralar isə onun yerində Məscid tikirlər». ***əl-Əziz*** adını, ***əl-Uzza –*** İbn Cərir – *rahmətullahi aleyhi* – deyir: «Məkkə ilə Taif arasında, Nəxl adlanan yerdə ağac adı idi». İbn Hişam deyir: «Məkkənin fəthi günü Xalid b. Valid - *radıyallahu anhu* – oranı dağıdır». ***əl-Mənnan*** adını, ***əl-Manat –*** Məkkə ilə Mədinə arasında, Hudeydə adlanan yerin adı idi. Aişə - *radıyallahu anhə* – deyir: «Əli - *radıyallahu anhu* – Məkkənin fəthi günü oranı dağıdır» . ***«Bir deyin görək Lat və Uzza nəyə qadirdir. Digəri üçüncüsü olan Manat da həmçinin…..O, bütlər sizin və atalarınızın qoyduqları adlardan başqa bir şey deyildir. Allah onlara dair bir dəlil endirməmişdir».*** *(ən-Nəcm 19-23).* ***«Allahdan başqa ibadət etdikləriniz sizin və atalarnızın qoyduğu adlardan başqa bir şey deyildir. Allah isə heç bir dəlil endirməmişdir. Hökm ancaq Allahındır. O, sizi yalnız Onun özünə ibadət etməyə çağırır».*** *(Yusuf 40).*

**2.** Allah - *subhənəhu və təalə* - yə layiq olmayan adı vermək. Məs: Yəhudi və Xristianların dediyi kimi Ata, oğul və bizim dilimizdə işlənən o, kişiyə qurban olum və s. ***«Şübhəsiz ki, Allah Məryam oğlu İsadır deyənlər kafir oldular. Halbuki, Məsih belə demişdir. Ey israil oğulları! Mənim də sizin də Rəbbiniz olan Allaha ibadət edin».*** *(əl-Maidə 72).*

**3.** Allah - *subhənəhu və təalə* – yə naqis sifətlər vermək. Məs: Yəhudilər və Xristianlar dedilər ki, Allah xəsisdir, göyləri və yeri xəlq etdikdən sonra dincəldi və s. ***Yəhudilər dedilər: «Allahın əlləri bağlıdır. Bu dedikləri sözə görə onların öz əlləri bağlandı və lənətə gəldilər. Xeyr! Allahın əlləri açıqdır, istədiyi kimi lütf və ehsan edər».*** *(əl-Maidə 64).* ***«O, nə mürgü nə də yuxu bilər».*** *(əl-Bəqərə 255).* Finhas adlı bir yəhudi Əbu Bəkr - *radıyallahu anhu* – onu İslama dəvət etdikdə demişdir: «Allaha and olsun ki, ey Əbu Bəkr! Biz fəqir (kasıb) olmadığımızdan Allaha ehtiyacımız yoxdur. O, isə fəqir birisidir. Əgər möhtac olmayan bir varlıq olmasaydı bizdən borc tələb etməzdi» ***«Allah kasıbdır, biz isə dövlətliyik! deyənlərin sözlərini Allah, əlbəttə eşitdi. Biz onların dediklərini və Peyğəmbərləri haqsız yerə öldürdük-lərini yazacaq və*** *(Qiyamət günü)* ***onlara: «Atəşin əzabını dadın!» deyəcəyik».*** *(Ali İmran 181)* . Allah bütün bu deyilənlərdən münəzzəhdir.

**4.** Allah - *subhənəhu və təalə* - nin Sifətlərinə keyfiyyət isnad edib və onun Sifətlərini Allahın yaratdıqlarına bənzədən – ***Müşəbbihlər*** (bənzədənlər). Bunlar müşriklərdən də pisdirlər. Müşriklər yerdəkiləri Allaha şərik qoşurlar, onlar isə Allahı yaratdıqlarına bənzədirlər. ***«Allah ona aid etdikləri sifətlərdən uzaqdır».*** *(əs-Saffət 159).* ***"Ona bənzər heç bir şey yoxdur. O, (hər şeyi) eşidəndir, (hər şeyi) görəndir!".***

---

[470] Buxari.
[471] İbn Cərir ət-Təbəri təfsir kitabında. Sənədi zəifdir.

*(əş-Şura 11).* ***"Heç yaradan** (Allah) **yaratmayana bənzəyərmi?! Məgər düşünmürsünüz?!".*** *(ən-Nəhl 17).* ***"O, göylərin və yerin, onların arasında olan hər şeyin Rəbbidir! Yalnız Ona ibadət et və Onun ibadətinə səbirli ol! Heç** (Allahın özündən başqa)* ***Ona bənzərini** (Onun adını daşıyan başqa birisini)* ***görmüsənmi?** (Müşriklər öz bütlərinə tanrı, ilahi desələr də, heç zaman onlara Allah adını verməzlər)**".*** *(Məryəm 65).*

**5.** Allah - *subhənəhu və təalə* – nin İsim və Sifətlərini qismən və ya tamamilə inkar edən – ***Muattila*** (Cəhmilər). Onların iddialarına görə Allahın İsim və Sifətlərini qəbul etmək Allahı yaratdıqlarına bənzətmək deməkdir. ***Bunlar Da İki Qismdirlər***:

**1)** Allahın İsimlərini qəbul edərək mənasız olduğunu qeyd edirlər. Bütün bunlara ***Sifəti Səlbiyyə*** – Uca Allahın zatına və varlığına yaraşmayan, uca Allah haqqında imkansız olan vəsflərdir. ***Səlb Etmək*** – qaldırmaq, uzaqlaşdırmaq mənasındadır. Bunlar da ***Sifəti Səlbiyyə*** və ***Sifəti Subutuyyə*** başlıqları altında sayılan on dört sifətin ziddidir. Bunlar ***Adəm*** (yoxluq), ***Hudus*** (sonradan var olmaq), ***Fəna*** (varlığının sonu olması, bəlli bir müddətdən sonra yox olub getməsi), ***Təaddüt*** (ortağı, şəriki,köməkçiləri olması), ***Muşabəhət*** (sonradan yaradılmış bir şeyə bənzəməsi, bənzəri və oxşarı olması), Başqalarına möhtac olmaq, Ölü və ya cansız olmaq, ***Cahil*** (elmsiz, biliksiz), ***Aciz*** (gücsüz olmaq), İradəsiz olmaq, Görməmək, kor olmaq, Eşitməmək, kar olmaq, Danışmaması, Yaratmamaq.

**2)** Bütün İsim və Sifətləri inkar edənlər.

Əvvəla bütün bunlar batil fikirlərdir. Çünki Allah Qurani-Kərimdə bir çox ayələrdə İsim və Sifətlərinin olduğunu buyurduğu halda, digər ayələrdə heç bir şeyin İsim və Sifətlərində ona bənzəmədiyini buyurmuşdu. Əgər bu İsim və Sifətləri qəbul etmək, onu yaratdıqlarına bənzətməyi irəli sürmüş olsaydı, Allahın ayələrinin bir qisminin digərini yalanladığını qəbul etməli olardıq. Allahın ***Səmi*** – (eşidən) olduğunu bilirik. Eşitmək isə məna etibarı ilə səsləri qəbul (idrak) etmək deməkdir. Lakin Allahın eşitməsinin həqiqi mənası bizim tərəfimizdən bilinməzdir. Çünki biz iki şəxs gördükdə: Bu ikisinin insanlıq xüsusiyətləri olan eşitmək, görmək və danışmaq kimi xüsusiyətlərinin eyni olduğunu fikirləşmirik. Məs: İnsanın ayağı, əli olduğu kimi hər hansısa bir heyvanın da əli, ayağı vardır. İnsanın da gücü var, heyvanında, İnsanında eşitmə, görmə orqanı var, heyvanında. Bu sifətlər eyni adı daşıyırlar. Lakin keyfiyyət və forma cəhətdən bir-birindən çox fərqlənirlər. Bundan da belə bir nəticə çıxır ki, adların eyni olması, onların keyfiyyət və formalarının eyni olması demək deyildir. Çarpayının üstünə istiva etmək ilə dəvənin üstünə istiva etmək arasında fərqlər vardır. Bütün bunlar yaradılanlar arasında fərqli olduğu halda, Yaradıcı (Allah) ilə yaradılan (məxluq) arasında belə bir fərq daha açıq və daha böyükdür. Allah Öz sifətləri barəsində bizə xəbər vermişdir, lakin onların forma və keyfiyəti barəsində bir xəbər yoxdur. Sən nə qədər onları təsəvvür etməyə çalışsan Allah daha Uca və Böyükdür. Bütün bunlar da vacib edir ki, Müsəlman bir kimsə nə qəlbi, nə dili, nə də qələmi ilə Allahı təsəvvür etməyə çalışmasın.

**6.** ***Bilinməsi Vacib Olan Qaydalar***: Allahın İsimləri xüsusi İsimlər və Sifətlərdir. Xüsusi İsimlər o, zaman adlanır ki, bu İsimlərin sahibindən danışılarsa, əgər onların

---

[472] ***Sifəti Səlbiyyə*** - Qidəm (qədimlik), Bəqa (əbədilik), Vahdəniyyə, Muxalifə Lil Xalq Vəl Həvədis, Ğinə (Qiyamu Bin Nəs). ***Sifəti Subutiyyə*** – Uca Allahın zatına yaraşır və zatından ayrılmayan, əzəli və əbədi olan vacib sifətlərdir. Allah bu sifətlərlə əzəldən bəri vəsflənmişdir. Bu sifətlərin heç biri sonradan qazanılmış sifətlər deyildir. Bu sifətlər – ***Həyat*** (Furqan 58), ***Elm*** (Ali İmran 29), ***İradə, Qüdrət, Bəsir, Səmi, Kəlam, Təkvin*** (yoxdan var etməsi).

mənalarından danışılarsa bu zaman sifət adlanır. ***əl-Həyy, əl-Alim, əs-Səmi, əl-Basir*** və s. Bütün qramatika alimləri qeyd edirlər ki: ***əl-Alim*** – adlandırılır elm sahibi olan, ***əs-Səmi*** – adlandırılır eşidən, ***əl-Basir*** – adlandırılır görən. Lakin zəlalət əhli Allahın isimlərini onların həqiqi mənalarından məhrum edərək deyirlər ki: Allah ***əs-Səmi*** – lakin eşitmir, ***əl-Basir*** – lakin görmür, ***əl-Alim*** – lakin elimsizdir, ***əl-Qadir*** – lakin güclü deyildir. Onlar bunu belə əsaslandırırlar ki, Allahın sifətlərini qəbul etmək Onu məxluqatın sifətlərilə eyniləşdirməkdir. Lakin bütün bunlar Quran, Sünnə və sağlam düşüncəyə zidd olan sözlərdir. ***"O, bağışlayandır, rəhm edəndir!".*** *(əl-Əhqaf 8).* ***"Həqiqətən, sənin Rəbbinin intiqamı çox şiddətlidir! Həqiqətən,*** *(insanı)* ***yoxdan var edən və*** *(öldükdən sonra)* ***təkrar diridən Odur!*** *(Bəndələrini)* ***çox bağışlayan, çox sevən də Odur. Ərşin sahibi də, şanlı-şərəfli olan da Odur! O, istədiyini edəndir".*** *(əl-Buruc 12-16).* ***"****Ya Peyğəmbər!)* ***Ən uca olan Rəbbinin adını pak*** *(müqəddəs)* ***tutub şəninə təriflər de! O Rəbbin ki,*** *(hər şeyi)* ***xəlq etdi və nizama saldı. O Rəbbin ki,*** *(hər şeyin keyfiyyətini, xüsusiyyətini, davam müddətini)* ***əzəldən müəyyən etdi və*** *(hamıya)* ***yol göstərdi. O Rəbbin ki,*** *(torpağı yarıb ondan yamyaşıl)* ***otlar çıxartdı. Sonra da onu*** *(qupquru)* ***qara çör-çöpə döndərdi".*** *(əl-Əla 1-5).* Bu aylər Allaha xas olan bir çox sifətlərindən xəbər verir. İnsan ağlı özü-özlüyündə Allahın İsimlərini təyin etməkdə acizdir. Mütləq Quran və Sünnəyə müraciət edilməlidir.

Allahın Sifətləri gözəl İsimlərindən daha çoxdur. Çünki hər bir Sifət İsmə və həmçinin də Allahın əməllərinə müvafiqdir. Allahın əməlləri saya-hesaba gəlməyəndir, Onun sözlərinin sayı-hesabı olmadığı kimi? ***"Əgər yer üzündəki bütün ağaclar qələm, dərya da arxasından yeddi dərya qatılaraq*** *(mürəkkəb)* ***olsaydı, yenə də Allahın sözləri*** *(yazmaqla)* ***tükənməzdi. Həqiqətən, Allah yenilməz qüdrət, hikmət sahibidir!".*** *(Loğman 27).* Biz bu Sifətlərin Allahın gözəl sifətlərindən olduğuna iman gətiririk, lakin onların Allahın İsmi olduğunu söyləmirik.

***Allahın Sifətləri İki Qrupa Ayrılır***: 1. Zatı ilə bağlı olan Sifətlər. Bu Sifətlər hər bir zaman Allahın Zatına məxsusdur. Məs: ***əl-İlim*** (Elm), ***əl-Qudra*** (Qüdrət), ***əs-Səmi*** (Eşitmək), ***əl-Basar*** (Görmək), ***əl-İzza*** (İzzət), ***əl-Hikmə*** (Hikmət), ***əl-Uluv*** (Ucalıq), ***əl-Azama*** (Əzəmət), ***əl-Vəch*** (Üz), ***əl-Yədəh*** (Əl), ***əl-Ayneyn*** (İki göz) və s. 2. Allahın Əməlləriylə bağlı (Feli) Sifətlər. Allah istədiyi vaxt edir, istədiyi vaxt isə etmir. Məs: ***əl-İstiva*** (Ərşə yüksəlmək), ***ən-Nuzul*** (Enmə) və s. Allahın Sifətləri içərisində həm Allahın Zatı, həm də Allahın əməlləri ilə bağlı Sifətləri də vardır. Məs: ***əl-Kəlam*** (Danışmaq). Bu Sifət Allahın Zatı Sifətlərindəndir. Eyni zamanda Allahın feli Sifətlərindəndir. Çünki Allah istədiyi zaman və istədiyi şeyi danışır. ***"Bir şeyi*** *(yaratmaq)* ***istədiyi zaman*** *(Allahın)* ***buyurduğu ona ancaq: "Ol!" deməkdir. O da dərhal olar".*** *(Yasin 82).* Qurani Kərimdə Allahın Sifətləri barəsində üç cür dəlil vardır: 1. Açıq-aydın ayə və hədlərdə keçən Allahın Sifətləri. Məs: ***əl-İzza*** (İzzət), ***ər-Rahmə*** (mərhəmətli), ***əl-Bətş*** (Güc, qüvvət), ***əl-Vəch*** (Üz), ***əl-Yədəh*** (Əl) və s. 2. Allahın İsimlrindən alınan Sifətlər. Məs: əl-Ğafur (Bağılayan), ***əl-Məğfira*** (Bağışlamaq) və s. 3. Allahın fellərindən alınan Sifətlər. Məs: ***əl-İstiva*** (Ərşə yüksəlmək), ən-Nuzul (Enmə), əl-İntiqam (İtiqam alan) və s. İbn AbdulBərr – *rahmətullahi aleyhi* – deyir ki: "Sünnə əhli həmfikirdilər ki, Allahın Sifətlərinə iman gətirmək vacibdir. Həmçinin vacibdir onları birbaşa mənaları ilə başa düşüb qəbul etmək, məcazi mənada (təvil) olunmuş yox. Bununla bərabər onlara forma verilməməli və müəyyən hədd ilə məhdudlaşdırmamalıyıq"[473]. Qadi Əbu Yala – *rahmətullahi*

---

[473] İbn Teymiyyə "Fəva əl-Həməviyyə".

*aleyhi* – deyir ki: "(Quran və Sünnədə) gələn dəlilləri onların həqiqi mənalarına zidd olaraq inkar etmək və təvil (yozmaq) olmaz. (Allahın Sifətlərini) birbaşa gəldiyi şəkildədə başa düşmək lazımdır. Çünki Allahın Sifətləri eyni adlı olan məxluqatının sifətlərinə oxşamaz. İmam Əhməd – *rahmətullahi aleyhi* – və s. imamların dediyi kimi onları məxluqatın sifətlərinə oxşatmaq olmaz"[474].

**7.** ***Mühüm Qaydalar***: **Bir:** Öz sifətləri haqqında bizə xəbər verən Allah: ***"Onun heç bir tayı-bərabəri*** *(bənzəri)* ***də yoxdur!".*** *(əl-İxlas 4).* Bəndələrinə Ona şərik qoşmağı və məxluqları ilə müqayisə etməyi qadağan etmişdir. ***"Allah qoşduğunuz şərikləri,*** *(Onun yaratdıqlarını)* ***Allaha bənzətməyin. Allah*** *(heç bir şəriki olmadığını, heç bir məxluqun Ona bənzəmədiyini)* ***bilir, siz isə*** *(bu həqiqəti)* ***bilmirsiniz!". (ən-Nəhl 74). "İndi siz də Allaha*** *(Onun heç bir oxşarı və bənzəri olmadığını)* ***bilə-bilə şəriklər qoşmayın!".*** *(əl-Bəqərə 22).* Bütün bunlar haqdır. **İki:** O, kimsədən soruşmaq lazımdır: Sən təsdiq edirsən ki, Allahın zatı yaratdıqlarının zatına bənzəməz?". O: "Bəli" deyərsə bu zaman ona demək lazımdır ki: Allahın zatının heç bir bənzəri olmadığına iman gətrdiyin kimi, Allahın Sifətlərinin də heç bir bənzəri olmadığına iman gətir və onları məxluqların sifətləriylə müqayisə etmə? Kim Allahın zatı ilə Sifətləri arasında sərhəd qoymağa çalışarsa artıq özünə zidd getmiş olur". ***Üç:*** Ondan soruşmaq lazımdır: "Məgər sən görmürsən ki, eyni adlı sifətlər məxluqlar arasında (əl, ayaq, göz və s.) forma və keyfiyyətinə (oxşarlığına) görə fərqlənirlər?". O: "Bəli, görürəm" deyərsə bu zaman ondan soruşun: "Əgər sən bu qədər fərqi görür və dərk edirsənsə sənə nə mane olur ki, Xaliq ilə məxluq arasında olan böyük və əzəmətli fərqi anlamayasan?". Xaliq ilə məxluqun bir-birinə bənzəməsi mümkün deyildir. Bu haqda artıq danışılmışdır. ***«Ey iblis, sənə mənim iki əlimlə yaratdığıma səcdə etməyə nə mane oldu»*** *(Sad 75).* Bir kimsə desə ki, burada "*Əlimlə*" kəliməsindən Allahın əli deyil başqa bir şey qəsd olunur (qüdrət, nemət və s.), biz ona: Hansı dəlilə əsasən sən açıq-aydın olan bu kəliməni (mənanı) inkar edərək, orada başqa bir şey qəsd olunduğunu söyləyirsən? Bu Allaha atılmış ən böyük böhtandır. Həmçinin Peyğəmbər – *sallallahu aleyhi və salləm* – in, səhabələrin və ilk əsr alimlərin tutduqları yola ziddir. Bununla sən dolayı yolla da olsa deyirsən ki, nə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* –, nə səhabələr, nə də ilk əsr alimlər bu barədə bilmirdilər, lakin sən onlardan elmli çıxıb bu məsləni başa düşmüsən. Bu isə ən böyük yalan və böhtandır". ***Dörd:*** Allahın sifətlərini təvil edən bir kimsədən soruş: "Məgər sən Allahı onun özündən daha çox tanıyırsan?". O: "Xeyr" deyərsə ondan soruş: "Allahın özü-özünü vəsf etdiyi bu dəlillər (ayə və hədis) haqq deyil?". O: "Əlbəttə" deyərsə ondan soruşun: "Məgər sən Allahın kəlamından daha aydın və inandırıcı hər hansısa bir söz bilirsən?". O: "Xeyr" deyərsə yenə də ondan soruşun: "Sən düşünürsənmi ki, Allah insanlardan haqqı gizlədib ki, insanlar özləri onu axtarsınlar?". O: "Xeyr" deyərsə ondan soruş: "Məgər sən Allahı onun Rəsulu – *sallallahu aleyhi və səlləm* – dən daha gözəl tanıyırsan?". O: "Xeyr" deyərsə ondan soruş: "Məgər Allah Rəsulunun Rəbbi barəsində söylədikləri həqiqət deyil?". O: "Bəli" deyərsə yenə də soruş: "Məgər sən Allahın Rəsulundan daha aydın və başa düşüləsi tərzdə danışan bir kimsəni tanıyırsanmı?". O: "Xeyr" deyərsə soruş: "Məgər sən Allahın Rəsulundan daha doğru danışan bir kimsə tanıyırsan?". O: "Xeyr" deyərsə ona de: "Əgər sən bütün bunlara iman gətirirsənsə bəs nə üçün Allahın özü-özünü və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Onu vəsf etdiyi bu sifətləri olduğu kimi qəbul etmək istəmirsən? Necə sən Allahın özü-özünü vəsf etdiyi bu sifətləri başqa

---

[474] "İbtal əl-Təvil".

mənalarla vəsf edirsən? Dünya dağılar - Quran və Sünnənin təsdiq etdiyini təsdiq etsən və inkar etdiyini də inkar etsən? Nəticə etibarıyla bu daha gözəldir ki, Qiyamət günü də - *Peyğəmbərlərə nə cavab verdiniz?* – sualına da ləyaqətli cavab verəsən? Nueym b. Həmməd əl-Huzai – *rahmətullahi aleyhi* – deyir ki: "Kim Allahı məxluqa oxşatsa küfr etmiş olar. Kim Allahın Özünü vəsf etdiyi sifətləri inkar edərsə küfr etmiş olar. Allahın özü-özünü vəsf etdiyi Sifətlər və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Allahı vəsf etdiyi Sifətlər Allahı məxluqa oxşatmaq deyildir"[475].

**8.** ***Allahın Sifətləri Iki Qismdir***: **1.** Təsdiqlənmiş (Quran və Sünnə) ilə. əl-Həyat, əl-Qudra (Qüdrət), əl-İlim (Elm), əl-İstiva (Ərşə yüksəlmək), ən-Nuzul (Enmə), əl-Vəch (Cəmal (üz), əl-Yədh (əl) və s. Hər bir müsəlman bunların Allahın sifətləri olduğuna iman gətirməlidir. **2.** Rədd edilmiş (Quran və Sünnə) ilə. Allah münəzzəhdir Ona aid edilən: əl-Mout (ölüm), əl-Cahil (elimsizlik), ən-Nisyan (unutqanlıq), əl-Acz (acizlik), əl-Ama (korluq), əs-Samam (karlıq), əl-Qaflya (Qəflət), əz-Zulm (Zülm), ən-Noum (Yuxu) və s. ***"(Ya Rəsulum!) Ölməz, həmişə diri olana*** *(Allaha)* ***bel bağla və Onu həmd-səna ilə təqdis et...".*** *(əl-Furqan 58).* ***"Rəbbim*** *(heç bir şeydə)* ***xəta etməz və*** *(heç bir şeyi)* ***unutmaz!".*** *(Ta ha 52).* ***"Göylərdə və yerdə Allahı aciz edə biləcək heç bir şey yoxdur. Həqiqətən, O*** *(hər şeyi)* ***biləndir,*** *(hər şeyə)* ***qadirdir!".*** *(Fatir 44).* ***"Yoxsa onlar elə güman edirlər ki, Biz onların pıçıltılarını və xəlvəti danışıqlarını eşitmirik?! Xeyr, yanlarında olan elçilərimiz*** *(onların bütün aşkar və gizli söhbətlərini)* ***yazırlar!".*** *(əz-Zuxruf 80).* ***"Sənin Rəbbin – yenilməz qüvvət sahibi*** *(mülkündə hər şeyə qalib)* ***olan Rəbbin*** *(müşriklərin)* ***Ona aid etdikləri sifətlərdən tamamilə uzaqdır! Peyğəmbərlərə salam olsun! Aləmlərin Rəbbi olan Allaha həmd olsun!".*** *(əs-Saffət 180-182).*

**9.** İnsanlar arasında olan bəzi müraciətlər. Məs: Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurur: «Sizdən heç kim öz (qulluqçusuna) Rəbbini yedizdir, Rəbbinə dəstəmaz aldır və s deməsin. Lakin: "Seyyidim (ağam), Mövlam" desin. Sizdən heç kim mənim qulum, kənizim - deyə xitab etməsin. Lalkin: "Ey cavan, oğlum, qızım" desin .

## MUHƏMMƏDƏN RƏSULULLAH

***Mənası –*** Onun Allah tərəfindən göndərilmiş Peyğəmbər olduğuna inanmaq, onu sevməyin vacib olduğuna, əmr etdiyi şeylərdə ona itaət etməyə, verdiyi xəbərlərdə onu təsdiq etməyə və heç bir sözü onun sözündən irəli keçirməməyə inanmaq deməkdir. Bu iki şəhadət kəliməsi bir-birindən ayrılmazdır. Buna görə də həm azanda, həm də təşahüddə bir yerdə zikr edilir. əl-İnşirah surəsinin 4-cü ayəsində: ***«Sənin ad-sanını, şan-şöhrətini ucaltmadıqmı?»*** (Yerdə, göydə səndən söhbət gedər, xütbələrdə adın çəkilər). Mücahid – *rahmətullahi aleyhi* – deyir: «Mən xatırlanacaq olsam mütləq sən də xatırlanacaqsan. Şəhadət edirəm ki, Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur və Muhəmməd Allahın qulu və rəsuludur» .

Muhəmməd Allahın qulu və bütün insanlara, hətta cinlərə göndərdiyi Rəsulu olduğuna dair dilin söylədikləri sözə uyğun olaraq, qəlbin dərinliyindən bunu təsdiq etmək deməkdir. ***«Ya Peyğəmbər! Həqiqətən, biz səni*** *(ümmətinə)* ***bir şahid, bir***

---

[475] Zəhəbi "Uluv".
[476] Buxari 2552, Müslim 2249, Əbu Davud 4975, Nəsəi 10070.
[477] İbn İshaq «Fadlus Saləti alən-Nəbi» s.86. əl-Albani mursəl hədis.

***müjdəçi və bir qorxudan kimi göndərdik! Biz səni Allahın izni ilə ona tərəf çağıran və nurlu bir çıraq olaraq göndərdik!»*** *(əl-Əhzab 45-46).*

Buna görə də keçmişə dair verdiyi bütün xəbərlərdə, gələcəyə dair verdiyi bütün xəbərlərdə, halal və haram qıldığı bütün xüsuslarda onu təsdiq etmək, verdiyi əmrləri yerinə yetirmək, qadağan etdiklərindən uzaq olmaq. ***De ki: «Əgər Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızın üstünü örtüb sizi bağışlasın. Allah bağışlayan və mərhəmətlidir».*** *(Ali-İmran 31).* Əbu Hureyrə, AbdurRahmən b. Səhr - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - in belə buyurduğunu eşitdim: «Sizə nəyi qadağan edirəmsə ondan uzaq durun, nəyi sizə əmr etmişəmsə ondan bacardığınız qədər istifadə edin. Şübhə yox ki, sizdən əvvəlki ümmətləri çoxlu sual verməlləri və Peyğəmbərlərinə müxalif olmaları məhv etdi» .

Ona itaətin Allaha itaət olduğuna, ona üsyan etməyin Allaha üsyan olduğunu bilmək deməkdir. ***«Peyğəmbərə itaət edən şəxs Allaha itaət etmiş olur. Kim üz döndərsə bil ki, biz səni onların üzərində gözətçi göndərmədik».*** *(ən-Nisa 80).*

Çünkü Allahın risaləsini bizə təbliğ edən odur. Allah onun ilə dini bitirən, dinin təbliğini bitirmədən onun ruhunu almadı. O, ümmətini gecəsi gündüzü kimi aydın olan bir yolun üzərində buraxıb getdi. Ondan sonra bu yoldan həlak olandan başqası azmaz. ***«Onun əmrinə qarşı çıxanları başlarına gələcək bir bəladan, yaxud da düçar olacaqları bir əzabdan qorxsunlar»*** *(ən-Nur 63).* İmam Əhməd – *rahmətullahi aleyhi* – deyir: «Bu bəlanın nə olduğunu bilirsiniz? Bəla – şirkdir. Çünkü bir kimsə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sözlərindən bəzilərini rədd edəcək olursa, qəlbinə bir miqdar azmaq düşər və sonda da məhv olar» .

O, Allahın quludur, ona ibadət olunmaz. Muhəmmədin Rububiyyətdə, kainatın idarə edilməsində, ya da ibadətdə haqq sahibi olduğuna heç bir şəkildə inanmamalıyıq. Əksinə o, quldur, ona ibadət edilməz, o bir rəsuldur. O, Allahın istədiyindən artıq nə özünə, nə də hər hansı bir kimsəyə nə fayda, nə də zərər vermək gücünə malikdir. ***De ki: «Mən sizə demirəm ki, mənim yanımda Allahın xəzinələri vardır. Mən qeybi də bilmirəm və sizə də demirəm ki, mən mələyəm. Mən özümə gələn vəhyə tabe oluram». De ki: «Kor görənlə bir olurmu? Məgər düşünmürsünüz!»*** *(əl-Ənam 50).* ***«Peyğəmbərləri onlara cavab olaraq demişdilər: «Biz də sizin kimi adi bir insanıq. Lakin Allah öz bəndələrindən dilədiyinə nemət bəxş edər. Allahın izni olmadan biz sizə heç bir dəlil gətirə bilmərik».*** *(İbrahim 11).* ***«De ki: «Mən də sizin kimi ancaq bir insanam. Mənə vəhy olunur ki, sizin tanrınız yalnız tək olan Allahdır. Kim Rəbbi ilə qarşılaşacağına ümüd bəsləyirsə yaxşı iş görsün və rəbbinə etdiyi ibadətdə heç kəsi şərik qoşmasın»*** *(Kəhf 110).*

Ona əmr edilən şeylərə uyan bir əmirdir. ***De ki: «Mən sizə nə bir zərər, nə də bir xeyir vermək qüdrətinə malik deyiləm!» De ki: «Məni Allahdan heç kəs qurtara bilməz və mən ondan başqa heç bir sığınacaq tapa bilmərəm!»*** *(əl-Cinn 21-22).* ***De ki: «Mən Allahın istədiyindən başqa özümə nə bir xeyir, nə də bir zərər verə bilərəm. Əgər qeybi bilsəydim, sözsüz ki,*** *(özüm üçün)* ***daha çox xeyir tədarük edərdim və mənə pislik də toxunmazdı. Mən iman gətirən bir tayfanı qorxudan və müjdələyənəm»*** *(əl-Əraf 188).* Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Məni Xristianların İsa – *əleyhissəlam* – ı

[478] Buxari, Müslim.
[479] Şeyx Useymin «Üç əsas» şərhi.

öydükləri kimi öyməyin. Mən bir qulam, deyin Allahın qulu və rəsulu. Məni tərif etməkdə həddi aşmayın. Məni Allahın layiq bildiyi dərəcədən artıq yüksəltməyin. Rəbbim məni necə vəsf edibsə elə də vəsf edin» . Cündab b. Abdullah - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ölümündən beş gün qabaq buyurdu: «Nə badə məndən sonra əvvəlkilər kimi Peyğəmbərlərinin qəbirlərini ibadətgaha çevirəsiniz. Mən bunu sizə qadağan edirəm» . Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İlahi mənim qəbrimi ibadət olunan büt etmə. Öz Peyğəmbərlərinin qəbirlərini məscidlərə (ibadət olunan yerə) çevirən bir qövmə Allahın şiddətli əzabı tutar . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah Peyğəmbərlərinin qəbirlərini ibadətgaha çevirən Yəhudilərə və Xristianlara lənət etsin» . Beləliklə, bizə aydın oldu ki, nə Allahın Rəsulu, nə də ondan daha aşağı mərtəbədə olan yaradılmışlardan heç birisi ibadətə layiq deyildir. İbadət ancaq bir və tək olan Allaha edilir.

O, bütün yaradılmışların ən xeyirlisidir. Ən fəzilətli və Allah dərgahında ən dəyərli insandır. Dərəcə etibarı ilə ən yüksək və Allaha ən yaxın olandır. ***«Biz səni aləmlərə ancaq bir rəhmət olaraq göndərdik».*** *(əl-Ənbiya 107).* Yalnız azmışlar Allahın rəhmindən üz döndərərlər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü insanların seyyidi mənəm, qəbri açılacaq ilk kişi mənəm. İlk şəfaət edən və şəfaəti qəbul olunacaq ilk kişi də mən olacağam» .

Ona kitab vermiş, dinin əmini etmiş, risalətini təbliğ etməkdə və onu səhf etməkdən, xəta etməkdən qorumuşdu. ***«O, kefi istəyəni danışmır. Bu ancaq nazil olan bir vəhydir».*** *(ən-Nəcm 3-4).*

Onun risalətinə iman etmədikcə, Peyğəmbərliyini qəbul etmədikcə heç bir kimsənin imanı səhih olmaz. Ona iman edən Cənnətə, ona üsyan edən Cəhənnəmə girər. ***«Allaha and olsun ki, onlar öz aralarında baş verən mübahisələrdə səni hakim təyin etmədikcə və verdiyin hökmlərə görə öz nəfslərində sıxıntı duymadıqca və sənə tam şəkildə itaət etmədikcə iman sahibi olmazlar».*** *(ən-Nisa 65).* ***«Hər kəs özünə doğru yol aşkar olduqdan sonra Peyğəmbərlərdən üz döndərib, möminlərdən qeyrisinin yoluna uyarsa onu istədiyi yola yönəldər və Cəhənnəmə varid edərik. Ora necə də pis yerdir».*** *(ən-Nisa 115).*

Əvvəlki Peyğəmbərlər öz qövümlərinə, Muhəmməd – *sallallahu aleyhi və səlləm* – isə bütün bəşəriyyətə Peyğəmbər olaraq göndərildi. ***«Biz səni bütün insanlara müjdə verən, qorxudan bir Peyğəmbər göndərdik».*** *(Səba 28).* Cabir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bütün Peyğəmbərlər öz qövümlərinə göndərilib, mən isə hamıya göndərilən bir Peyğəmbərəm» .

Muhəmməd, Peyğəmbərlərin və Rəsulların sonuncusudur. O, Allahın risalətinin təbliği üçün seçdiyi son elçi, ona kitabların ən uca və ən əzəmətlisi endirilmişdi. O, Rəsulların əzəmətlisi, aləmlərin Rəbbinin həbibi və xəlilidir. ***«Muhəmməd aranızdakı kişilərdən heç birinin atası deyildir. Lakin o, Allahın Rəsulu və Peyğəmbərlərin sonuncusudur».*** *(əl-Əhzab 40).* Ondan sonra kim Peyğəmbərlik iddiasında olarsa

---

[480] Buxari, Əhməd.
[481] Müslim.
[482] İmam Məlik, Əhməd.
[483] Buxari, Müslim.
[484] Müslim, Əbu Davud 4673, Musnəd 2/540.
[485] Buxari, Müslim.

kafirdir, onu doğrulayan da kafirdir. Bunda şübhə edən də kafirdir. Mömin ondan sonra Peyğəmbərin olmayacağına iman edər. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Məni əvvəlki Peyğəmbərlərlə müqayisə etdikdə, bu o şeyə bənzəyir ki, bir insan gözəl bir bina tikir, onu bəzəyir və evin bir kərpicini qoymur. Camaat evə baxdıqda deyirlər: «Necə ola bilər ki, o bu kərpici qoymağı unudub?» Mən isə həmin o, sonuncu kərpicəm» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mənim isimlərim var. Mən ***Məhəmmədəm***, mən ***Əhmədəm***, mən ***Məhi*** (məhv edici) Allah mənimlə küfrü məhv edər. Mən ***Həşirəm*** – insanlar mənim ayaqlarımın izi ilə həşr olunurlar. Mən ***Akibəm***. Akib isə məndən sonra Peyğəmbər göndərilməyəndir» . Bu adlardan başqa: ***Muxtar*** (seçilmiş), ***Mustafa*** (arındırılmış), ***Şəfi*** (şəfaət edən), ***Muşəffə*** (şəfaət etdirilən), ***Sadiqul-Məsduq*** (doğru söyləyən və sözü doğrulanan) İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, doğru sözlü və sözü doğrulanan Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu…» , ***Fatih*** (fəth edən), ***Kusam*** (toplayan, birləşdirən, mükəmməl), ***Muqaffi*** (özündən əvvəl gələn Peyğəmbərlərin izini silən, sonuncu mənasındadır), ***Nəbiy Tövbə*** (tövbə Peyğəmbəri), ***Bəşir*** (itaət edəni müjdələyən, asi olanı cəza ilə qorxudan), ***Rauf*** (çox şəfqətli), ***Rahim*** (çox mərhəmətli). «Qurani Kərimdə keçən adlardan: ***Şahid, Mubəşşir*** (müjdəliyən), ***Rahmə*** (rəhmət), ***Nimə*** (nemət), ***Hadi*** (doğru yola yönəldən), ***Əmin*** (güvənilir) Qureyş onu Peyğəmbərlik verilməmişdən qabaq da bu adla çağırırdı, ***Muzəmmil*** (örtüyünə bürünən), ***Mudəssir*** (paltarına bürünən), ***Dailallah*** (Allaha dəvət edən) və s. İbn Dihyə – *rahmətullahi aleyhi* – deyir ki: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in adlarının sayı Uca Allahın adlarının sayı qədər doxsan doqquzdur» . İmam Zəhəbi – *rahmətullahi aleyhi* – deyir ki: «Onun adları arasında ***Dahuq*** (gülər üz) və ***Kattal*** (çox savaşan) adları da vardır». Əli - *radıyallahu anhu* – deyir ki: Allah onun üstünlüyünü ortaya qoymaq üçün ona öz adından törəmə bir ad qoydu: «Ərşin sahibinin adı ***Mahmud***, onun adı isə ***Muhəmməd***» .

Allah onu aydınlıq, doğru yola dəvət etmək üçün göndərdi. Onun risalətini inkar etmək Allaha dil uzatmaq, hətta Allahı rədd və inkar etməkdir. Səvban - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şübhəsiz ki, mənim ümmətimdən otuza yaxın yalançı çıxacaq. Onların hər birisi bir Peyğəmbər olduğunu iddia edəcəkdir. Mən isə Peyğəmbərlərin sonuncusuyam. Məndən sonra Peyğəmbər yoxdur» . O, insanlar içərsində Allahdan ən çox qorxan. «Sizin Allahdan ən çox qorxanınız və onun sərhədlərini ən yaxşı biləniniz də mənəm» . Allah onu insanlar arasından sevib, süzüb seçmiş və özünə yaxın bilmişdi. «Allah İbrahimi dost etdiyi kimi məni də özünə dost etdi» . ***«Allah və Peyğəmbəri bir işi hökm etdiyi zaman heç bir mömin kişiyə və qadına öz işlərində başqa yol seçmək yaraşmaz. Allah və onun Peyğəmbərinə asi olan şəxs şübhəsiz ki, haqq yoldan açıq-aydın azmışdır».*** *(əl-Əhzab 36).*

---

486 Buxari, Müslim.
487 Buxari, Müslim.
488 Buxari, Müslim.
489 əl-Fəth 6/643,644.
490 Zəhəbi «Siyer» 2/10: Bu adlar üçün Səhih Müslimə bax: 2354,2355.
491 Buxari, Müslim, Əbu Davud 4252, Musnəd 5/278.
492 Buxari, Ənəs b. Məlikin rəvayəti ilə.
493 Müslim.

Heç şübhəsiz ki, ona tabe olan və ona uyan hər kəs təqva sahibidir. ***«Aralarında hökm vermək üçün Allahın və Peyğəmbərinin yanına çağrıldıqları zaman möminlərin sözü ancaq eşitdik və itaət etdik deməkdən ibarətdir. Nicat tapanlar da məhz onlardır».*** *(ən-Nur 51).*

# MUHƏMMƏDƏN RƏSULULLAHIN ŞƏRTLƏRİ

***Lə İləhə İlləlləh*** kəlməsinin şərtləri olduğu kimi Muhəmmədən Rəsulullah - kəlməsinin də yeddi şərti var. Bu şərtlərin hər birinə əməl olunmadıqca, onların ifadə etdiyi mənaları Quran və Sünnəyə uyğun olaraq dolğun, düzgün başa düşülmədikcə, bu kəlmənin söylənilməsi heç bir kəsə fayda verməyəcəkdir. Aşağıda qeyd edəcəyimiz bu şərtlər Quran və Sünnəyə uyğun olaraq möhtərəm İslam alimləri tərəfindən qeyd olunmuşdu.

**1.** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Allahın Rəsulu olduğunu etiraf etməli və qəlbnən ona etiqad etməlidir. ***«Möminlər yalnız Allaha iman gətirən,*** *(iman gətirdikdən)* ***sonra heç bir şəkk-şübhəyə düşməyənlərdir».*** *(əl-Hucurat 15).*

**2.** Muhəmmədən Rəsulullahı dili ilə söyləməli və etiraf etməlidir. ***«Bunlar*** *(bu söylənilənlər)* ***Allahın ayələridir ki, onları sənə doğru-düzgün bildiririk».*** *(əl-Bəqərə 252).*

**3.** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – tabe olmaq, buyurduqlarını yerinə yetirmək və qadağalarından çəkilmək. ***De ki: «Əgər Allahı sevirsinizsə mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızın üstünü örtüb sizi bağışlasın. Allah bağışlayan və mərhəmətlidir».*** *(Ali-İmran 31).* Allah öz sevgisini peyğəmbərə itaətə bağlamışdır. Allahın sevgisini qazanmaq istəyən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sünnəsinə tabe olmalıdır.

**4.** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in verdiyi bütün xəbər-ləri təsdiq etmək. (Əmr, qadağalar, keçmişə və gələcəyə dair verdiyi qeybi xəbərləri). ***«Peyğəmbər sizə nə verirsə onu götürün, nəyi qadağan edirsə ondan əl çəkin. Allahdan qorxun. Həqiqətən Allahın cəzası çox şiddətlidir».*** *(əl-Həşr 7).*

**5.** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – i nəslindən, malından və cəmi insanlardan çox sevmək. ***«Peyğəmbər möminlərə onların özlərindən daha da yaxındır».*** *(əl-Əhzab 6).* Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizlərdən biriniz məni valideyinlərindən, övladlarından və cəmi insanlardan çox sevmədikcə imanı kamil olmaz»[494].

**6.** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sözünü yaradılmışların sözlərindən üstün tutmaq və onun sünnəsinə əməl etmək. ***«Ey iman gətirənlər!*** *(sözləriniz və əməllərinizlə)* ***Allahın və Peyğəmbərinin qabağına keçməyin».*** *(əl-Hucurat 1).*

**7.** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə hörmət və ehtiram göstərmək. ***«Həqiqətən biz səni bir şahid, bir müjdəçi və qorxudan bir Peyğəmbər olaraq göndərdik. Allaha və onun Rəsuluna iman gətirsəniz, ona yardım etsəniz, onu böyük sayıb ehtiramını saxlayasınız və Allahı səhər-axşam təqdis edib şəninə təriflər deyəsiniz».*** *(əl-Fəth 8-9).*

---

[494] Buxari, Müslim.

# NAMAZ VƏ ZƏKAT

***Namaz – Salət*** **-** lüğəti mənası dua deməkdir. ***«Onlardan ötrü*** *(salət)* ***dua et, çünki sənin duan onlar üçün bir arxayınçılıq və aydınlıqdır».*** *(ət-Tövbə 103).* ***İstilahi Mənası –*** Təkbirlə başlayıb (Allahu Əkbər ilə) başlayıb Təslimlə (salam verməklə) qurtaran, xüsusi kəlmələrdən və hərəkətlərdən ibarət olan ibadətdir. Məkkədə hicrətdən əvvəl fərz edilmişdir. Hicrətdən sonra isə Mədinədə azan, cümə, bayram, səfər, istiska və s. namazlar əmr edildi.

Namaz Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in göstərdiyi şəkildə qılınmalıdır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurur: «Mənim necə namaz qıldığımı görürsünüzsə, siz də elə namaz qılın» . Namazı gözəl bir şəkildə qılan kimsə üçün namaz Qiyamət günü bir nur, bir dəlil və bir qurtuluş səbəbi olacaqdır. ***«Həqiqətən möminlər nicat tapmışlar! O, kəslər ki, namazlarında müti olub boyun əyərlər».*** *(əl-Muminun 1, 2).*

***Zəkat –*** lüğəti mənası artmaq, çoxalmaq, təmizləmək, bərəkət olan bir kökdən gəlməkdədir. ***İstilahi Mənası*** **-** təyin olunmuş miqdara çatmış, məlum olan vaxda (ilin tamamında və ya məhsul yığımında) səkkiz sinif insanlar üçün ayrılan mal. Ona bu adın verilməsinin səbəbi zəkatın malın bərəkətini artırması, zəkat verən kimsəni malın şərindən qurtarması, simiclikdən uzaq olmasına görədir. ***«Onların mallarından sədəqə*** *(zəkat)* ***al. Bununla onları təmizləmiş, pak etmiş olarsan».*** *(ət-Tövbə 103).* Cabir - *radıyallahu anhu* – rəvayət edir ki, bir nəfər: «Ey Allahın Rəsulu! Əgər malın zəkatını versəm bu haqda fikrin nədir?» Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Malın zəkatını verən kimsədən o, malın şərri uzaqlaşır» . Hicrətin ikinci ilində Mədinədə fərz edilmişdir. Bəzi İslam alimlər qeyd edirlər ki, zəkat hicrətdən əvvəl Məkkədə fərz edilmişdir. Lakin miqdarı təqdir edilməmişdir. Mədinədə isə bu miqdar təyin edilmişdir. Buna dəlil də Məkkədə nazil olan bəzi surələrdə zəkatın fərz olduğunu göstərən ayalər yer aldığını söyləyirlər. ***«Yığım günü haqqını*** *(zəkatını, sədəqəsini)* ***ödəyin».*** *(əl-Ənam 141).* ***«O, kəslər ki, onların mallarında müəyyən bir haqq*** *(pay)* ***vardır. Dilənən və məhrum olan kimsə üçün».*** *(əl-Məaric 24,25).*

Bu iki ibadət növləri bir-birindən ayrılmazdılar. Qurani Kərimdə bir yerdə çox zikr olunurlar. ***«Halbuki onlara əmr edilmişdi ki, Allaha dini yalnız ona məxsus edərək, digər bütün batil dinlərdən islama dönərək ibadət etsinlər, namaz qılıb, zəkat versinlər. Doğru-düzgün din budur».*** *(əl-Bəyyinə 5).* Bu ayədə Allaha ibadət etmənin, namaz qılıb zəkat vermənin doğru din olması açıqlanmışdı. Allah doğru dini hər hansı bir əyrilik olmayan din adlandırmışdı. Allahın dinində əyrilik olmaz, o, mustəqimdir. ***«Bu şübhəsiz ki, mənim doğru yolumdur. Onu tutub gedin. Sizi Allahın yolundan sapdıracaq yollara uymayın. Allah sizə bunları tövsiyə edir ki, bəlkə pis əməllərdən əl çəkəsiniz».*** *(əl-Ənam 153).*

# NAMAZI TƏRK EDƏNİN VƏ ZƏKAT VERMƏYƏNİN AQİBƏTİ

Namazı tərk edib, şəhvətlərə uyanların aqibəti Qiyamət günü çox pis olacaqdır. ***«Onlardan sonra namazı tərk edib şəhvətə uyan bir nəsil gəldi. Biz onları Ğəyy***

---

[495] Buxari.
[496] Təbərani, əl-Albani «ət-Tərğib» 743-cü hədis.

***dərəsinə atacağıq».*** *(Məryəm 59).* ***«Sizi Cəhənnəmə salan nədir? Biz namaz qılanlardan deyildik».*** *(əl-Mudəssir 42-43).* Cabir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kişi (bir rəvayətdə: qul) ilə şirk və küfr arasında namazı tərk etməkdən başqa bir şey yoxdur. Qul onu buraxdığı zaman heç şübhəsiz ki, şirkə (bir rəvayətdə: küfrə) düşmüş olur» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurur: «Küfr ilə iman arasında namazı buraxmaq vardır» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bizim ilə onların arasında əhd namazdır. Kim onu tərk edərsə küfrə (şirkə) düşmüş olar» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim namazı bilə-bilə tərk edərsə Allahın himayəsi (rəhməti) onun üzərindən uzaq olar» .

Allah peşiman və rüsvay olunacaq gündə, qızıl, gümüş zəkatını verməyənlərin aqibətini belə bəyan edir. ***«Qızıl-gümüş yığıb onu Allah yolunda xərcləməyənləri şiddətli bir əzabla müjdələ! O, gün yığdıqları qızıl-gümüş Cəhənnəm atəşində qızdırılıb alınlarına, böyürlərinə və kürəklərinə dağ basılacaq. Bu sizin özünüz üçün yığıb saxladığınız mallardır. Yığdığınızın*** *(əzabını, acısını)* ***dadın! Deyiləcəkdir».*** *(ət-Tövbə 34-35).* ***«Allah tərəfindən bəxş olunmuş mal-dövləti sərf etməyə xəsislik edənlər heç də bunu özləri üçün xeyirli hesab etməsinlər. Xeyr, bu onlar üçün zərərlidir. Onların xəsislik etdikləri şey Qiyamət günü boyunlarına dolaşacaqdır. Göylərin və yerlərin mirası Allaha məxsusdur. Allah hər bir əməlinizdən xəbərdardır».*** *(Ali-İmran 180).* İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir qövm zəkat malını verməzlərsə onlara səmadan yağış yağması əngəllənər və əgər heyvanlar olmasa, onlara heç bir şəkildə yağış yağmazdı» . Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – dünyasını dəyişdikdən sonra Əbu Bəkr – *radıyallahu anhu* – nun xəlifəliyi (dövründə) bir qrup ərəblər (zəkat verməkdən imtina edərək) küfrə girirlər. (Əbu Bəkr – *radıyallahu anhu* – onlarla vuruşmağa qərar verdikdə) Ömər – *radıyallahu anhu* –: «Sən o, insanlarla necə döyüşə bilərsən ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurmuşdu: «Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına (və Muhəmmədin Allahın Rəsulu olduğuna) şəhadət edincəyə qədər insanlarla vuruşmağa əmir olundum. Bunu etdilərmi, İslamın haqqı müstəsna olmaqla öz qanlarını və mallarını məndən qorumuş olarlar. Haqq-hesablarını çəkmək isə Allaha aiddir» dedi. Əbu Bəkr: «Allaha and olsun ki, namaz və zəkatı bir-birindən ayıranlarla vuruşacağam. Çünki zəkat malın haqqıdır. Allaha and olsun ki, onlar Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ödədikləri bir dəvə yulanını belə məndən əsirgəmiş olsalar bundan ötrü onlarla vuruşacağam» deyə cavab verdi. Ömər: «Vallahi başa düşdüm (gördüm) ki, tək Allah özü Əbu Bəkr – *radıyallahu anhu* – nun

---

[497] Müslim 82, Əhməd 3/370,389, Əbu Davud 4678, Tirmizi 2618-2620, İbn Məcə 1078-1080, Muhəmməd b. Nəsr əl-Mərvəzi «Tazimu Kadris Salah» 886-892 və s. əl-Albani «Səhihul Cəmius Səğir» 2848-2849,5388, «Səhihut Tərğib» 1/298,560,565, «Mişkətul Məsabih» 569.

[498] Tirmizi 2618, əl-Albani 2849.

[499] Əhməd 5/346,355, Tirmizi 2621, Nəsai 1/231-232, İbn Məcə 1079, İbn Əbi Şeybə «əl-Musənnəf» 30387, İbn Hibban «əl-İhsan» 1454, Darakutni 1733, Beyhəqi «Sünnən Kubra» 3/366, «Şuabul İman» səh. 43 və s. Bureydə b. əl-Husayb əl-Əsləm - *radıyallahu anhu* – dan. əl-Albani «Səhihut Tərğib» 561, «Səhihul Cəmius Səğir» 4143, «Mişkətul Məsabih» 574.

[500] İbn Məcə. əl-Albani «İrvalul Ğəlil» 7/8991.

[501] İmam Əhməd, əl-Albani «Səhih Silsilə» 106-cı hədis.

[502] Buxari 25, Müslim 22.

köksünü onlarla döyüşməyə açmışdır və başa düşdüm ki, doğru olan da elə budur» . Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah kimə mal verdiyi halda zəkatını ödəməyəcək olursa, Qiyamət günündə o, mal ona gözləri üzərində iki qara nöqtə olan bir əjdaha şəkilində göstərilir. Bu əjdaha qiyamət günü onun boynuna dolanır. Onu çənələri ilə yaxaladıqda: «Mən sənin malınam, mən sənin yığıb gizlətdiyin xəzinənəm». ***«Allah tərəfindən bəxş olunmuş mal-dövləti sərf etməyə xəsislik edənlər heç də bunu özləri üçün xeyirli hesab etməsinlər. Xeyr, bu onlar üçün zərərlidir. Onların xəsislik etdikləri şey Qiyamət günü boyunlarına dolaşacaqdır. Göylərin və yerlərin mirası Allaha məxsusdur. Allah hər bir əməlinizdən xəbərdardır».*** *(Ali-İmran 180)»* . Əhnəf b. Qeys - *radıyallahu anhu* – deyir ki, qureyşlilərdən bir topluluğun yanında oturmuşdum. Saçlar, paltarı və görnüşü çox da yaxşı olmayan biri gəldi. Onların başlarının üstündə dayanaraq: «Mal yığıb gizlədənləri Cəhənnəm atəşində qızdırılacaq daşlarla müjdələ. Daha sonra bu qızdırılanlar onların məmə uclarına qoyulacaq, sonra isə çiyinlərinin isə üst tərəfindən çıxacaqdır. Yenə də qızdırılan daşlar çiyinlərinin üst tərəfindən qoyularaq məmə uclarından çıxacaqdır…» .

## ORUC

***Oruc*** **–** lüğəti mənası tutmaq, saxlamaq deməkdir. ***İstilahi Mənası*** - dan yeri ağarandan gün batana qədər qadağan olmuş şeylərdən (yemək, içmək və cinsi əlaqəyə girməkdən) çəkinmək. Quran və Sünnə ilə orucun rukun olması icma ilə qəbul edilmişdir. ***«Ey iman gətirənlər! Oruc tutmaq sizdən əvvəlki ümmətlərə vacib olduğu kimi, sizə də vacib edildi».*** *(əl-Bəqərə 183).* ***«Oruc sizin üçün bilsəydiniz nə qədər xeyirlidir».*** *(əl-Bəqərə 184).* Hicrətin ikinci ilində Mədinədə fərz edilmişdir.

Hər bir həddi buluğa çatan ramazan ayında orucu mütləq tutması vacibdir. Oruc tutan insan çox sayda xeyir qazanır. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim Ramazan orucunu ixlasla və əcrini umaraq ibadət edərsə keçmiş günahları bağışlanar» . əl-Albani – *rahmətullahi aleyhi* – deyir: «Əgər insanın günahı yoxdursa, oruc onun dərəcələrinin artmasına kömək edir» .

## ORUC TUTMAYANLARIN AQİBƏTİ

Ramazan ayında Oruc tutmamaq böyük günahlardandır. Müsəlman bir kimsə özünü Allahın qəzəbindən və cəzasından özünü qorumalıdır. ***«Ey iman gətirənlər! Özünüzü və əhli-əyalınızı elə bir oddan qoruyun ki, onun yanacağı insanlar və daşlardır».*** *(ət-Təhrim 6).* Əbu Umərmə əl-Bəhili - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yatdığım zaman yanıma iki nəfər gəldi. Məni qollarımdan tutub, çıxılması olduqca çətin olan bir dağın yanına gətirdilər və çıx dedilər». Mən bunu bacarmaram, dedikdə: «Biz onu sənin üçün asanlaşdırarıq, dedilər». Mən də dağa çıxdıqda dağın təpəsindən olduqca dəhşətli səslər eşitməyə

---

[503] Buxari 139, Müslim 20.
[504] Buxari «Zəkat» 3/110.
[505] Buxari 2/112, Müslim şərhi 3/29.
[506] Buxari, Müslim.
[507] əl-Albani «Səhih Tərğib» 1/415.

başladım. «Bu səslər kimin səsləridir?» dedim: «Bunlar Cəhənnəmliklərin ulaşmalarıdır, dedilər». Sonra məni götürüb, topuqlarından asılmış bir topluluğun yanına gətirdilər. Ağızları parça-parça olmuş, ağızlarından qan axırdı. Mən dedim: «Bunlar kimlərdir?» Bunlar oruc açmaları halal olmadan qabaq oruclarını yeyənlərdir .

## HƏCC

***Həcc* –** ibadət məqsədi ilə ilin müəyyən vaxtında Məkkəni ziyarət etmək. ***«Onun yolunda gücü çatan hər bir kəsin Həccə gedib o, evi ziyarət etməsi insanların Allah qarşısında borcudur».*** *(Ali-İmran 97).* Hicrətin doqquzuncu ilində fərz etmişdir. Hicrətin **8-**ci ili Məkkənin fəthindən sonra. Allah Bəytul-Haramı Həcc etməyi islamın rukunlarından olduğunu qeyd edir. Gücü catan, sağlam olan və imkanı olan hər bir kəsin Həcc etməsi vacibdir. Həcc ömürdə bir dəfə vacibdir. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ey insanlar! Allah üzərinizə Həcc etməyi fərz qıldı, artıq siz də Həcc edin». Bir nəfər: «Ey Allahın Rəsulu, hər il Həcc edək?». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – susdu. Həmin şəxs sualını bir neçə dəfə təkrarladı. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Əgər mən hə desəm, sizə hər il Həcc etmək vacib olardı. Sizin də buna gücünüz çatmazdı» . İmkanı olanın Həcc etməsi vacibdir. İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həcc etməyə tələsin. Çünki sizdən hər hansı bir kimsənin irəlidə başına nə gələcəyini bilməz» . Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim Həcci gözəl bir şəkildə, günah və pis əməllərə yol vermədən edərsə evə anadan doğulmuş kimi qayıdar» . Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Gözəl Həcc edənin mükafatı isə Cənnətdən başqa bir şey deyildir» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həcc ibadətinizi necə edəcəyinizi məndən öyrənin» .

## HƏCC ZƏİFLƏRİN VƏ QADINLARIN CİHADIDIR

əl-Həsən b. Əli - *radıyallahu anhu* – rəvayət edir ki, bir nəfər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən soruşdu: «Mən həm qorxaq həm də zəif bir kimsəyəm. «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «O, halda silahsız cihada get. Həccə» . Aişə - *radıyallahu anhə* – rəvayət edib deyir ki, Ey Allahın Rəsulu, cihad əməllərin ən fəzilətlisidir, bəs biz cihad etməyək. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Xeyir, sizin üçün ən fəzilətli cihad həccdir» . Ömər - *radıyallahu anhu* – deyir ki, bəzi bölgələrə adam göndərib imkan sahibi olub

---

[508] əl-Albani «Səhih Tərğib» 1/420, 995-ci hədis.
[509] Müslim.
[510] əl-Albani «Səhih Hədislər Silsiləsi» 2954.
[511] Buxari, Müslim.
[512] Buxari, Müslim.
[513] əl-Albani «Səhihul Cəmi» 4937.
[514] Təbərani, əl-Albani «Səhihul Cəmius Səğir» 6921.
[515] Buxari.

lakin həcc etməyən kimsələri tapsınlar və onlara cizyə vursunlar deyə içimdən bir şey keçdi. Çünki beləələri müsəlman deyildir, müsəlman deyildir» .

# İMAN

İman məfhumu olduqca çox mühüm bir məsələdir. Əgər iman məfhumu düzgün başa düşülərsə onun üzərində qurulan ibadətlər də düzgün olar. Yox əgər səhf başa düşülərsə bunun üzərində yaranan ibadətlərə də xələl gələr və bu da Sıratal mustəqimdən çıxmaqdır. Batiniyyə firqələrin yaranmasına səbəb də onların iman məfhumunu yaxşı başa düşmədiklərinə görədir. Şeyx Albani – *rahmətullahi aleyhi* – deyir ki: «Xəta üzərində bina edilmiş hər bir şey xətadır».

İnsanın bu məsələdə ilk qəsdi Elm öyrənməkdir. O, elm ki, söz və əməldən qabaqdır. Gizli namaz və qəlbin ibadətidir. İbadətin ən ucasıdır. Elmsiz iman olmur, imansız isə elm olur. Elmin şərəfliyi öyrənilən şeyin şərəfindən aslıdır. Ən şərəfli elm də Allahın dinidir. Bu da dəlillərlə Allahı, Peyğəmbərini və İslam dinini öyrənmək deməkdir. Sələflər deyərdilər ki, bir şeyi bildikdən sonra ona əməl et ki, onun əhlindən olasan. Buna görə də bu işdə bilinməsi vacib olan ikinci məsələ isə öyrənilənlərə əməl etməkdir. Öyrəndiyi şeylərə əməl etməyən insan səhrada belində su daşıyan dəvəyə və ya belində kitablar daşıyan eşşəyə bənzəyir hansı ki, bunların ona heç bir faydası yoxdur. Bundan sonra bu əməl etdiklərinə dəvət  etmək və sonda bu yolda məruz qaldığın bütün çətinliklərə səbr etməkdir. ***«And olsun axşam çağına ki, insan ziyan içindədir. Yalnız iman gətirib yaxşı əməllər edən, bir-birinə haqqı tövsiyə edən və səbri tövsiyə edən kimsələrdən başqa».*** *(əl-Əsr 1-3).* İmam Şafii – *rahmətullahi aleyhi* – deyir ki: «Əgər uca Allah qullarına qarşı bu surədən başqa bir hüccət (dəlil) nazil etməmiş olsaydı, bu surə onlara bəs edərdi». Bu niyyətlə də İslam həyatı yaşanır. İslam da bu yolla insanın həyatında yaşanır. İnsanlar içərisində eləəri də vardır ki, bütün işlərində İslamı yaşayırlar. İslam da bu insanların mövcudluğu ilə yaşanır. Bütün bunlar Allahın Kitabından, Peyğəmbərin Sünnəsindən və səhabələrin sözlərindən götrülərək öyrənilir.

İslam alimləri bu iman məfhumu ilə çox maraqlanmışlar. Öz kitablarında bu mövzuya ayrıca yerlər ayırmışlar. İslam düşmənləri isə çalışırlar ki, insanları bu iman məfhumundan yayındırsınlar. Əgər insanlar bu məfhumdan yayınarlarsa heç şübhəsiz ki, onlar düzgün yoldan da yayınarlar.

Şükürlər olsun ki, Allah iman ağacını öz xeyirli bəndələrinin qəlbində əkir, onu mənfəətli elmlə suvarmış və qidalandırmışdır. Onlara gecə və gündüz Allahı anmağı bəxş etmişdir. İnsanın səadətdən, xoşbəxtlikdən olan payı da bu ağacdan olan payına görədir. Nə qədər onunla maraqlanarsa dünya və axirəti də onunla xoşbəxt olar. O, iman ki, onun əsası tövhiddir. O, iman ki, dünyada möhkəmlənmək üçün bir yoldur. Zəlilliyi müsəlmandan qaldıraraq izzətə aparan yoldur. Müsəlmanların yer üzündə möhkəmlənməsinə, zəlillikdən, əzabdan çıxaran səbəbdir. Müsəlmana da vacibdir bu iman məfhumunu (şöbələ-rini, bölümlərini) öyrənsin, imanını kamilləşdirməyə çalışsın. ***«Allah aranızdan iman gətirib yaxşı işlər görənlərə yalnız Mənə ibadət edərlər, heç nəyi Mənə şərik qoşmazlar deyə – onları özlərindən əvvəlkilər kimi yer***

---

[516] Sünnən Beyhəqi.

[517] ***Dəvət*** – Dəvət edən insan ilk öncə bəzi xüsusiyyətlərə sahib olmalıdır. 1. Elmli olmaq. 2. Dəvət etdiyi məsələni bilməlidir. 3. Elminə əməl edənlərdən olmalıdır. 4. İxlas olmalıdır. 5. Hikmətli omalıdı. Dəvətin rükunları. 1) Dəvət edən. 2) Dəvət olunan. 3) Vasitə olmalıdır. Vasitə isə haram şeylərdən olmamalıdır.

***üzünün varisləri edəcəyini, möminlər üçün onların Allahın özü bəyəndiyi dinini*** *(İslamı)* ***möhkəmləndirəcəyini və onların qorxusunu əmin-amanlıqla, arxayınçılıqla əvəz edəcəyini vəd buyurmuşdur. Bundan sonra küfr edənlər şübhəsiz ki, əsl fasiqlərdir».*** *(ən-Nur 55).* ***Subhənəllah****!* Bu da Allahın öz bəndələrinə olan vədi. Bir şərtlə ki, bizlər imanlarımızı xalis Tövhid üzərində qurmalıyıq.

## İMAN AĞACI

***«Məgər Allahın necə məsəl çəkdiyini görmürsənmi? Xoş bir söz*** *(Lə İləhə İlləllah, Muhəmmədən Rəsulullah)* ***kökü yerdə möhkəm olub budaqları səmaya ucalan gözəl bir ağac*** *(xurma ağacı)* ***kimidir. O, ağac Rəbbinin izni ilə hər vaxt bəhrəsini verir. Allah insanlar üçün belə məsəllər çəkir ki, bəlkə düşünüb ibrət alsınlar!*** *(Ağacın kökü yerdə, budaqları göydə olduğu kimi möminin də imanı qəlbində sabit qalır, əməlləri isə göyə – Allahın dərgahına yüksəlib ona daim savab qazandırır).* ***Pis söz isə yerdən qopardılmış, kökü olmayan pis bir ağaca bənzəyir».*** *(İbrahim 24).* Allah – *subhənəhu və təalə* – buyurur ki, biz insanlar üçün misallar çəkirik. Həqiqi insanlar kimlərdir? Müsəlmanlar və möminlərdir. Çünki bu misallardan ibrət alanlarda məhz onlardır. Allah bu misalları məhz müsəlmanlar və möminlər üçün çəkir ki, ibrət alsınlar. Bəzi ayələrin axırında gəlir ki – ***Yətəzəkkərun –*** yada salmaq, bəzilərində isə – ***Yətəfəkkərun*** – fikirləşmək deməkdir. Təfəkkur – ibrət almaq Təzəkkurdan daha geniş və irəlidir. İnsanın bu misalları dərk etməsi üçün ağlını işlətməsidir. Bu ayələrdən hikmətlər, hökmlər, ibrətlər çıxarması üçündür. ***«…Onun ayələrini düşünüb dərk etsinlər və ağıl sahibləri də*** *(ondan)* ***ibrət alsınlar!».*** *(Sad 29).* ***«And olsun ki, Biz Quranı*** *(ondan)* ***ibrət almaq, öyüd-nəsihət qəbul etmək üçün belə asanlaşdırdıq. Amma hanı ibrət alan, öyüd-nəsihət qəbul edən!».*** *(Qəmər 17).* ***«Onlar Quran barəsində düşünməzlərmi!».*** *(ən-Nisa 82).* ***«****(Ey Məkkə əhli!)* ***Biz onu ərəbcə bir quran olaraq nazil etdik ki, bəlkə*** *(mənasını)* ***anlayasınız».*** *(Yusuf 2).* ***«****(Ya Muhəmməd!)* ***Rəbbindən sənə nazil edilən Quranın haqq olduğunu bilən*** *(haqqı görməyən)* ***korla eyni ola bilərmi? Yalnız ağıl sahibləri öyüd-nəsihət qəbul edərlər!».*** *(ər-Rəd 19).* Onların imanları donmuş halda deyildir. Diri imandır. Onlar elmlərini iman dəlili üzərində qururlar. Allah onları zikr edərək buyurur ki, onlar bildiklərinə əməl edənlərdir, ağıllarını və qəlblərini işlədənlərdir.

İlk öncə ***Təfəkkur***, sonra isə ***Təzəkkur*** gəlir. ***Təzəkkur –*** elm üzərində qurulan əməldir. O, elm ki, Quran və Sünnədən alınıb. Bu da Quranda çəkilən misalların Uca dərəcəsi olduğunu, həmçinin də Allah bu misalları çəkir ki, biz də bu misallarla çox maraqlanaq. Çünki bu misalları başa düşməkdə insanın hidayəti və düzgün yolu tapmağı vardır. Misallar ağlı tərəfdən olan qiyaslardır. Bununla da aydın olur ki, qiyas təkcə fiqhi məsələlərdə deyil həmçinin etiqadi məsələrdə də olur. Lakin bu misalların qiyasını Allah özü zikr edir. Ümumən insanlara caiz (icazə verilmir, bəyənilmir) ki, elm əhlinin çəkmədiyi qiyası özləri çəksinlər. Allah – *subhənəhu və təalə* – misal çəkməyi qadağan edərək buyurur: ***«****(Allaha qoşduğunuz şərikləri, Onun yaratdıqlarını)* ***Allaha misal çəkməyin. Allah*** *(heç bir şəriki olmadığını, heç bir məxluqun Ona bənzəmədiyini)* ***bilir, siz isə*** *(bu həqiqəti)* ***bilmirsiniz».*** *(ən-Nəhl 74).* Azanların çoxu da elə bu qapıdan azmışlar.

---

[518] ***Fiqh*** – lüpətdə anlamaq, başa düşmək mənasındadır. ***İstilahi*** (şəriətdə isə) – Quran və Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in sünnəsindəki (hədislər-dəki) dəlillərdən çıxarılan şəriət hökmləri ilə bağlı olan elm.

***«Məgər Allahın necə məsəl çəkdiyini görmürsənmi?»*** – Ayənin başlanğıcı təəcüblüyü, qəribəliyi artırmaq üçündür. Təəcübdə yalnız misalı biləndən sonra olur. Misalın çəkilməsində olan birinci fayda da misalı eşidən insanın diqqətini fikirləşməyə yönəltməkdir. Quran ayələrinin ecaskarlığı da elə bundadır. Məs: Başqa ayədə də Allah – *subhənəhu və təalə* – fil sahiblərinə necə divan tutduğunu buyuraraq: ***«Məgər Rəbbinin fil sahiblərinə nələr etdiyini görmədinmi…».*** *(əl-Fil 10).* Bu misalı başa düşdükdə bu təəcüüb, qəribəlik onda hasil olur. Yəni bu misalı sənin üçün çəkirəm ey insan! Sən də ağlını bu misalı başa düşməyə yönəldəsən. Allah bu misalları çəkdikdə insanların bildikləri, gördükləri bir şeyi onlara misal çəkir. Eşidən insanda bu bilinən bir şey olmalıdır ki, insan bu misalın həqiqətini başa düşsün. Buna görə də deyirlər ki, misal eşidən, dinləyən insanda bilinən bir şeyə misal çəkilir. Əgər bilinən bir şeyə misal çəkilməzsə bu misal insanın qaranlığını daha da artırar. Alimlər Quran misallarına aid bir çox kitablar yazmışlar. İnsanlara olduqca faydlıdır ki, mənəvi bir şeyi daima müşahidə etdikləri bir şeylə insanın başına çatdırıldıqda o, mənanı daha yaxşı başa düşürlər.

Allahın çəkdiyi bu misal çox əzəmətli bir misaldır. Misal olaraq Allah gözəl bir ağacı çəkir. Bu ağac daima yaşıl olan Xurma ağacıdır. İbn Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ağaclar içərisində daima yaşıl və yarpağı tökülməyən bir ağac vardır. O, ağac möminə (müsəlmana) bənzəyir. Deyin görüm o, hansı ağacdır?». Səhabələr: «Ətrafda olan ağacları sadalamağa başladılar (Lakin düz demədilər)». İbn Ömər: «Mən bu ağacın xurma ağacı olduğunu qəlbimdən keçirdim. Lakin (yaşım kiçik olduğu üçün) söyləməyə utandım. Çünki Əbu Bəkr və Ömər – *radıyallahu anhum* – kimi səhabələrin orada olduqları halda danışmırdılar». Səhabələr: «Ya Rəsulullah! Bizə söylə görək bu hansı ağacdır» dedilər. Peyğəmbər: «Bu xurma ağacıdır» deyə buyurdu. Mən bunu (oradan çıxandan sonra) atama (Ömərə) dedim. O, da: «Sənin bu xurma ağacıdır demiş olmağın mənim üçün filan şeydən daha sevimli olardı» .

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu ağacı müsəlmana, möminə bənzətmişdir. Bu hədislərin Sünnədə bəyanı o, qədər çoxdur ki, hətta ***Mutəvatir*** - dərəcəsinə çatmışdır.

Təfsir alimləri bu kəliməni iki cür təfsir etmişlər. Bəziləri qeyd edirlər ki, bu gözəl kəlimə Şəhadət kəliməsidir – ***Lə İləhə İlləllah*** **-** Muhəmmədən Rəsulullah. Bəziləri də qeyd edirlər ki, bu gözəl kəlimə Allahın kəlamıdır (Quran və Sünnə). Dəlil olaraq da: ***«Allahın kəlamı doğruluq və ədalət baxımından tamamlandı».*** *(əl-Ənam 115).* Lakin bunların arasında heç bir ziddiyət yoxdur. İkisidə eyni mənanı daşıyırlar. Çünki birinci söz ***Lə İləhə İlləllah*** **–** Muhəmmədən Rəsulullah özü də ikinci sözə qayıdır. Quranın hamısı, Sünnə, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – gətirdikləri Şəhadət Kəliməsini bəyan edir. ***«Allah özündən başqa heç bir ilah olmadığına şahiddir. Mələklər və elm sahibləri də haqqa-ədalətə boyun qoyaraq o qüvvət və hikmət sahibindən başqa ibadətə layiq heç bir ilah olmadığına şəhadət verdilər».*** *(Ali-İmran 18).* ***«Lakin*** *(Ya Muhəmməd!)* ***Allah sənə nazil etdiyi*** *(Quran)* ***ilə şəhadət verir ki, onu öz elmi ilə nazil etmişdir. Mələklər də buna şahidlik edirlər. Təkcə Allahın şahid olması yetər».*** *(ən-Nisa 166).* Allahın şəhadəti haradadır? Quran və Sünnədə. ***«De ki:***

---

[519] Buxari, Mülim 2811.

[520] ***Mutəvatir*** – bir çox ravi tərəfindən rəvayət olunub, səhihliyində heç bir şübhə olmayan, hamılıqla qəbul olunan hədis.

***«Şahidlik baxımından nə daha böyükdür? Mənimlə sizin aranızda Allah şahiddir. Bu Quran mənə sizi və ona yetişəcək kimsələri xəbərdarlıq edib qorxutmağım üçün vəhy olundu. Məgər siz Allahla yanaşı başqa tanrılar olduğuna şahidlik edirsiniz? De ki: «O, tək bir tanrıdır. Mən sizin Ona şərik qoşduqlarınızdan*** *(bütlərdən)* ***təmamilə kənaram».*** *(əl-Ənam 19).*

İlk əvvəl bu ağac əkiləndə ya toxum şəkilində, ya da budaq şəkilində əkilir ki, bu da ana ağacdan götrülür. Bu ağac ilk əvvəl əkiləndə zəif olur. Həmçinin sənin qəlbində əkilən o, ***Lə İləhə İlləllah*** ağacı da zəif olur, nə vaxt ki, qul bu kəliməni söyləyir. Əgər insan bu misalı başa düşsə qəlbində olan iman ağacını da başa düşəcəkdir. Bu ağac zəif olduğuna görə ona yaxşı qulluq etmək lazımdır ki, böyüyərək gözəl bar (meyvə) versin. Buna görə də bu ağacı vaxtlı-vaxtında suvarmalı, kübrələməli və qidalandırmalısan. Əgər bu qida olmasa ağac böyüməz və bar da verməz. Çünki zəif olduğuna görə onu istənilən heyvan, həşərat yeyib məhv edə bilər. Allah buyurur ki, bu ağacın kökü sabitdir. Kökləri möhkəmdir. Budaqları, şaxələri isə səmaya yüksəlmişdir. Allah buyurur ki, gözəl ağac heç vaxt gözəl olmaz əgər o, bar (meyvə) verməzsə. Burada qeyd olunan ağac da mənfəətli ağacdır. Çünkü öz bəhrəsini, səmərəsini hər vaxt verir: ***«O, ağac Rəbbinin izni ilə hər vaxt bəhrəsini verir».*** Bu söz həmçinin onu da bildirir ki, bu ağac digər ağaclardan da fərqlənir. Çünki bizim bildiyimiz ağaclar hər vaxt bəhrə vermir. Bu da Quran misallarının xüsusiyyətlərindəndir ki, əgər o misalda naqislik olarsa ora əlavə bəyan artırılır. Allah başqa ayədə buyurur ki: ***«Mallarını Allah yolunda sərf edənlərin halı yeddi sünbül verən bir toxuma bənzər ki, bu sünbüllərin hər birində yüz ədəd dən vardır. Allah istədiyi şəxs üçün bunu qat-qat artırır. Allahın lütfü genişdir. O, hər şeyi biləndir».*** *(əl-Bəqərə 261).* Bir toxum yeddi sünbül vermir. Sadəcə Allah bu misalları çəkir ki, insanlar imana yönəlsinlər və onun həqiqətini başa düşsünlər. Bu ağac da yavaş-yavaş böyüyərək Allahın vəsf etdiyi kimi olur. Kökü möhkəm, budaqları isə səmaya yüksələn. Əgər insan bu ağaca qulluq etməkdə səhlənkar yanaşarsa və ya onun kökünə yararsız su, ağacı həlak edən bir şey tökərsə o, ağac korlanar. Bu ağacın hissələrini iman tərəfdən nə qarşılayır? Bu ağacla müqayisədə nə kimi şeylər vardır?

Bir kimsə ***Lə İləhə İlləllah*** kəliməsini Allah və Rəsulunu sevərək etiqad tərəfdən deyərsə, onun mənasını bilərsə, tələb etdiklərini təsdiq edərsə artıq bu ağacın ilk anlarını ağacın gövdəsini, kökünü qarşılayır. ***Lə İləhə İlləllah*** kəliməsi sağlam fitrət üzərində onun qəlbinə əkilir və buradan da onun qəlbində həyat başlayır. Qəlbində iman bitir. Qəlb bu imanla yaşayır və diri olur. Lakin bu da kifayyət deyildir. Çünki bu ağaca baxmaq, onu kübrələmək (qidalandırmaq) lazımdır. Bu da elm öyrənməklə olur. ***Lə İləhə İlləllah*** kəlimsini ikinci qarşılayan elm öyrənməkdir. Bu elm də Quran və Sünnədən alınır. Elm öyrənmək bu ağaca verilən su yerindədir. Su ilk növbədə ağacın köklərinə gedir və oradan da ağac qidalanmağa başlayır. Elm də yavaş-yavaş əldə edilir. Sələflər deyərdilər: «Elmin yolu uzundur». İmam Zuhri – *rahmətullahi aleyhi* – deyir ki: «Kim elmi birdən almaq istəyərsə elm ondan birdən gedər» . Əli -

---

[521] ***Elmin Fəziləti: «Əgər bilmirsinizsə zikr əhlindən soruşun».*** *(əl-Ənbiya 7).* Muaviyə - *radıyallahu anhu*– rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah kimə xeyir diləyərsə onu dində fəqih edər» Buxari 71, Müslim 1038, Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dünya lənətlənmişdir. İçində olan hər bir şeydə lənətlənmişdir. Yalnız (elm) öyrənən və öyrədəndən başqa» Tirmizi 2323, Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim ki, Allah rizası üçün öyrənilməsi lazım olan bir elmi sırf dünya malını əldə etmək üçün öyrənərsə Qiyamət günü Cənnətin iyisini belə duymaz» Əbu Davud 3664, ***«Beləliklə hər bir ölkənin günahkarlarını oranın başçıları təyin***

*radıyallahu anhu* – rəvayət edir ki: «Elm əməllə cilovlanır. Əks halda isə (elmə əməl edilmədikdə) sahibini tərk edir» . Elmi yavaş-yavaş öyrənməklə də insan zəlalətdən nura (hidayətə) yavaş-yavaş çıxır. Zəlalət əhlindən bir qrup bu misallara qarşı çıxaraq demişlər ki, vəli (Allahın dostu) cəhd göstərsə onun üçün bütün elmlər Lövhi-Məhfuzda kamil surətdə açılar. Artıq bu misal onların bu fikirlərinin batil olduğunu göstərir. İnsan Şəhadət Kəliməsini deməklə olduğu zəlalətdən bir başa çıxmır. Hidayətə kamil surətdə çıxa bilməz. Onun kamil surətdə çıxması üçün elm lazımdır ki, bu elm də yavaş-yavaş əldə edilir. İman insana yavaş-yavaş gəlir. İnsan yavaş-yavaş elm əldə etdikcə imanı da bir o, qədər yavaş-yavaş artır. İmanın möhkəmlənməsi də elmlə olur. Artdıqca, böyüyür və möhkəmlənir. Böyüyərək böyük bir ağac olur. Əgər ilk əvvəl onu hansısa bir heyvan, həşarat yeyib məhv edə bilərdisə indi isə bu böyük və möhkəm ağacı heç kəs yerindən tərpədə də bilməz. O, ağac da sənin qəlbində möhkəmləndikdə şübhələr, şəhvətlər də sənə təsir edə bilmir. Qəlbdə olan iman ağacı elmlə artır və bu ağac kimi möhkəm olur. Bu ağacın budaqları və şaxələri vardır. Budaqları olmasa bu ağac gözəl ağac ola bilməz. Çünki meyvəsi də ola bilməz. İmanın da şöbələri vardır. Əgər ağacdan budaqları kəsilərsə o, ağac ölər. O, budaqların kəsilməsilə ağacın meyvə vermək ehtimalı da azalır və ağac özü də zəifləyir. Bu da imanın azalmasına dəlildir. İnsan günah etdikdə İslamdan çıxmır. Çünki gövdə (kök) hələ də qalır. Ağacın kökü isə qəlbin əməllərini qarşılayır. Su ilə köklər qidalanır. Deməli elmlə qidalanan ilk öncə qəlbin əməlləridir. Bunun üzərində də əqidələr yaranır. Əgər qəlbin əməlləri elmlə qidalanarsa bunun təsiri də zahiri əməllərə çıxır. Əbu Abdullah ən-Numan b. Bəşir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – in belə buyurduğunu eşitdim: «…Bunu da bilin ki, insan bədənində elə bir ət parçası var ki, əgər o, sağlam olarsa bütün bədən sağlam olar, yox əgər o, xəstə olarsa onda bütün bədən xəstə olar. Bilin ki, bu qəlbdir» . Bu ağacın kökü yerdə möhkəm, budaqları isə səmaya yüksəlmişdir. Bu ağacın əsli dedikdə gövdəsi nəzərdə tutulur. Allah buyurur ki, əsası möhkəm olan bir sözdür. Quru və boş bir söz deyildir (Şərtləri və Rukunları olan bir kəlimədir). Hansı ki. kökləri vasitəsi ilə yerə birləşmişdir. Ağacın kökləri ağacı yerə dartaraq onu möhkəm saxlayırlar. Köklər nə qədər güclü olarsa ağac da möhkəm olar və küləklər, qasırğalar ona təsir edə bilməz. İman elmsiz möhkəm ola bilməz. Elm və əmələ görə iman artır və azalır. Yaxşı elm öyrənməklə iman artır, pis elm öyrənməklə iman azalır. Yaxşı əməl etməklə iman artır, pis əməl etməklə isə iman azalır. Əsas qəsd elmə əməl etməkdir. Əgər insan elminə əməl etməzsə qəlbində olan iman da bununla təsirlənər. Həmçinin insan əsası Quran və

---

***etdik..».*** *(əl-Ənam 123).* Abdullah b. Amr b. əl-As - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Həqiqətən də Allah elmi insanlardan almaz. Lakin elmli insanların ruhlarını almaqla elmi onlardan qaldırar. Beləki heç bir alim qalmadıqda insanlar özləri üçün cahilləri başçılar təyin edərlər. Onlara da sual verildikdə elmsiz olaraq fətva verərlər. Bununla da həm özləri zəlalətə düşər, həm də başqalarını zəlalətə salarlar» Buxari 100, Müslim 2673, Kəb b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Kim elmi alimlərlə mübahisə etmək üçün, səfehləri susdurmaq üçün, insanların diqqətini özüvə çəkmək üçün, başa düşməyənləri şübhəyə salmaq üçün və məclislərdə yer tutmaq üçün öyrənərsə Cənnətin iyini belə hiss etməz» Tirmizi 2656. Həm hədisdir, həm də əsər İbn Məsud - *radıyallahu anhu* – dan, Ömər - *radıyallahu anhu* – rəvayət edir ki: «Həqiqətən hər bir kəs evindən dağ boyda günahla çıxa bilər və elm aldıqdan sonra Allahdan qorxub günahlardan çəkinər və tövbə edər, beləliklə də mənzilinə günahsız qayıdar. Elm məclislərini tərk etməyin» Miftahud Darus Səadə 1/77, Əli - *radıyallahu anhu* – rəvayət edir ki: «Elm var-dövlətdən daha xeyirlidir. Elm səni qoruyar, var-dövləti isə sən qoruyarsan. Elm hakimdir, var-dövlət isə məhkumdur. Var-dövlət yığanlar məhv oldu, elm öyrənənlər isə həmişə yaşayırlar. Özləri ölüb getsələr də (adları) daima qəlblərdədir» Ədəbud Dunya vəd Din s. 48.

[521] Buxari 52; Müslim 1599.

[522] əl-Cəmi 2/11.

[523] Müslim.

Sünnədən götrülməyən bir elm öyrənərsə: Məs: Kəlam, Fəlsəfə və ya öz ağlı ilə ayə və hədisləri təfsir edərək əməl edərsə bu da qəlbdə olan imanı korlayır və qəlbdə olan imanı pis elmlə qidalandırır. Bu da pis su ilə və pis dərman ilə ağacı qidalandırmağa bənzəyir.

***«Allah göylərin və yerin nurudur. Onun nuru içində çıraq olan bir taxçaya bənzər. Taxçadakı o, çıraq bir qəndilin içərisindədir, o qəndil isə sanki parlaq bir ulduzdur. O, çıraq nə şərqdə, nə də qərbdə*** *(aləmin ortasında)* ***mübarək bir zeytun ağacından yandırılır. Onun*** *(zeytun ağacının)* ***yağı özünə od toxunmasa da sanki*** *(az qala)* ***işıq saçır. O, nur üstündə nurdur. Allah dilədiyini öz nuruna qovuşdurur. Allah hər şeyi biləndir».*** *(ən-Nur 35).* İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: ***«Allah göyləri və yerlərin nurudur…»*** buyuruğunda göyləri və yerləri nurlandıran, göylərdə və yerdə olanlara doğru yol göstərən kimi təfsir etmişdir. Onun nuru ilə göylərdə və yerdə olanlar doğru yol tapır. Allahın gözəl İsimlərindən biri olan «***Ən-Nur***» adı da buradan Ona verilmişdir. Uca Allah bu nura, onun olduğu yerə, Onu daşıyana və onun maddəsinə qəndil oyuğunu misal çəkmişdir. Bu isə evin divarının içərisində düzəldilmiş oyuq formasında xüsusi bir yerdir. Bu qəndil oyuğunda ən şəffaf şüşədən düzəldilmiş pəncərə vardır. Şəffaflığından və ap-aydın olmasından par-par parıldayan ulduza bənzədilmişdir. Bu da qəlbə bənzəyir. Qəlb is şüşəyə bənzədilmişdir .

Allahın bəndəsinin qəlbinə qoyduğu nur taxçadakı çırağa bənzəyir. O, çıraq qəndildir. O, qəndil də bir ulduz kimidir. Bu qəndil də yandırılır mübarək zeytun ağacının yağı ilə. Zeytun yağların ən təmizi və tör-töküntüsü olmayandır. Bu ağac da nə şərqdədir, nə də qərbdə. Tən ortadadır. Günəş batanda da, doğanda da onun üzərinə düşür. Çünki ağacın üzərinə nə qədər çox günəş şüaları düşərsə bir o, qədər də bəhrəsi də gözəl olar. Zeytun ağacının yağının saflığı və təmizliyi üzündən ona od toxunmasa da belə işıq saçır. Bu zeytun yağı son dərəcə təmiz və şəffaf olduğundan və öz-özünə işıq saçdığı üçün ona od toxunduqda işıqlığı daha da artar və onda işıq saçan maddə güclənir və nəticədə isə o, nur üstündə nur olur. Allah öz nurunu istədiyinə yönəldir. Burada imanın nuruna misal çəkilmişdir. Bu misalda isə məsəl nurun məsəlidir. Nur da imandan hasil olan nurdur. Bununla möminin qəlbi işıqlanır. Bu işıqla o, ətrafı da işıqlandırır. Onun bərəkəti hər şeydən böyük və azmaqdan ən uzaq olan vəhy ağacıdır. Bu nurun sayəsində mömin xeyir və şərriin yerini bilir. Allah töminə nur verir o, da bu nurun sayəsində həyatın yollarında gəzir, xeyir və şərr olanı seçir. Salehlərlə, talehləri və zəlalət yollarını ayırd edir. ***«Allah*** *(Ona)* ***iman gətirənlərin dostudur. Onları zülmətdən çıxarıb işığa tərəf yönəldər. Kafirlərin dostu isə Tağutdur. Onları nurdan ayırıb zülmətə salarlar. Onlar cəhənnəmlikdirlər və orada əbədi qalacaqlar».*** *(əl-Bəqərə 257).*

Allah buyurur ki, nur üstündə nurdur. Alimlər deyirlər ki, birinci nur elmdir. Bu da qəlbdə olan imanı suvarır. İkinci nur isə iman nurudur. Allah bu nuru bəndənin qəlbinə qoyur. Əgər o, qəlbində olan çırağı yandırarsa və onu yağla suvararsa qəlbi işıqlanar. Sonra bu nur zahirə çıxar. Bəndənin həm ağlında, həm də zahiri əməllərində biruzə verər. Həmçinin o, çıraqda olan yağ artır. Hər dəfə ora təmiz yanacaq doldurularsa onun verdiyi nur da, işıq da təmiz olar. Yox əgər o, lampaya pis yağ (yanacaq) doldurularsa görərsən ki, o şüşə içəridən qaralar. Hətta o, qədər zülmətləşir ki, şüşənin xaricinə işıq, nur çıxmaz. İnsan zülmətlər içərisində olar. Bu iki misalın birləşdiyi

---

[524] İbn Qeyyim «İləmul Muvaqqin» 1/185, «Təfsirul Qeyyim» s. 375, «Vabilus Sayyib» s. 736.

nöqtə hansıdır? Birləşdiyi nöqtə odur ki, nur mürəkkəbdir. Bir şey deyildir. Həmçinin də iman da mürəkkəbdir. Bir şey deyildir. Bundan başqa bu iki məsəl daha böyük bir işdə cəmləşmişlər ki, bu da imanın güclü olması, saleh olması üçün elmin zəruriliyidir. O, elm ki, Quran və Sünnədən götrülüb. Əgər bir kəs imanını güclü elm üzərində qurarsa qəlbindəki elm ağacı ilə maraqlanarsa, tövhid üzərində qurarsa o, insan sabit olar. Allah onu imanı sayəsində dünya və axirətdə sabit edər. ***«Allah iman gətirənləri dünya və axirətdə möhkəm bir sözlə sabitqədəm edər. Allah zalimləri*** *(haqq yoldan)* ***sapdırar. Allah istədiyini edər».*** *(İbrahim 27).* Bu da böyük səmərə və bəhrədir.

***«Xoş bir söz*** *(Lə İləhə İlləllah, Muhəmmədən Rəsulullah)* ***kökü yerdə möhkəm olub budaqları səmaya ucalan gözəl bir ağac*** *(xurma ağacı)* ***kimidir».*** Budaqlardan qəsd olunan əməllərdir. Səmaya yüksələn isə onun əməllərinin qəbul olunmasıdır. Bu ağac Uca və İzzətli ağacdır. Bu da dəlildir ki, Şəhadət Kəliməsini söyləyən insan izzətli insandır. Allah ona verdiyi imana görə izzətləndirir. Heç bir məxluqun qarşısında zəlil olmur. Mömin insan həmişə başı yuxarı, izzətlidir. Əgər o, imanını kamilləşdirirsə və səhihləşdirirsə. Yox əgər imanı ilə maraqlanmazsa onun izzəti, imanı zəiflədiyinə görə zəifləyər. İmanın bərəkəti müsəlmanın üzərindən heç vaxt kəsilmir. Həm bu dünya, həm də axirətdə. İmanın ən böyük bərəkəti isə möminin Allahın dostlarından olur. Budaqların səmaya yüksəlməsinə görə deyiblər ki, möminin özü yerdə olsa da özü isə Allah ilə bərabərdir. Bu da xüsusi bir bərabərlikdir ki, biz bu haqda Allahın ***Məiyyə*** – birlikdə olmaq sifəti haqqında olan babda danışmışıq. Hər bir sıxıntıdan, dərddən onu qurtarır. Cənnəti qazanar, qəbr əzabından və qiyamətin dəhşətindən qurtuluşa çatar.

## İMANIN TƏRİFİ VƏ TƏFSİRİ

Əşyanın tərifi və onu bəyan edən təfsir həmişə əhkamlardan əvvəl gəlir. Əşyalara hökm verməк onun təsəvvüründən yaranan bir hissədir. Əgər bir kəs hökm verəcəyi bir şeyin təfsirini bilmədən, dəqiqliklə təsəvvür etmədən ona hökm verərsə o, böyük bir səhf etmiş olar. İnsan bir şeyə hökm verməsi üçün əvvəlcə onu təmamilə təsəvvür etməlidir. Fətva verən, tərif verən o, tərif verdiyi şeyin həqiqətini bilməlidir. Əgər o, şeyi təsəvvür etməsə ona tərif verə bilməz. Tərifləri isə əsasən elm əhli verir. O, kəslər ki, bu tərif verdikləri şeylər barəsində elmi kamilləşib. Hər bir şeydə o, şeyin həqiqətini, təsəvvürünü bilməlisən. Nə qədər güclü təsəvvür edərsə ona verilən tərif də bir o, qədər güclü olar. İnsanın məsələni yaxşı başa düşməsi, təsəvvür etməsi ona verdiyi tərifi daha da yaxşı edir. Bu tərifler də ictihadidir. Müəyyən bir formada Quran və Sünnədə gəlməyib. O, şey ki, onun barəsind tərif gəlməyib elm əhli o, haqda tərifi ictihad edirlər. Buna görə də onların tərifləri ləfz tərəfdən fərqlənirlər. Lakin məna tərəfdən isə onların tərifləri birləşir. Bu da yalnız Əhli Sünnədə olur. Onlar da tərif verməkdə Quran və Sünnəyə əsaslanırlar. Tərifləri bidət əhlinin təriflərindən fərqlənir. Buna görə də Əhli Sünnə ilə müxaliflər arasında iman məfhumu barəsində ixtilaf yaranmışdır. Çünki onların tərif verməkdə dəstəkləndikləri tək yer lüğət tərəfdəndir. Onlar imana tərif verməkdə dil tərəfi (lüğəti mənanı) götürərək istilahi (şərri) tərəfdən də tərifi ona əsaslandırmışlar. Demişlər ki. dil tərəfdən (lüğəti məna) necədirsə şərri mənası da o, cürdür. Buna görə iddia edirlər ki, imanın lüğəti mənası tək təsdiqdir. Təsdiq və iman sinonim sözlərdir. Aralarında heç bir fərq yoxdur. Onlar bununla böyük bir xətayə yol vermişlər. Xətaları isə istilahi (şərri) tərifi təyin etmək üçün dil tərəfə (lüğəti mənaya) yönəlmişlər. İbn Teymiyyə - *rahmətullahi aleyhi* – «İman» kitabında bu məsələyə diqqət yönəltmiş və demişdir ki, imana tərif verməkdə tək lüğəti

tərəfə etimad edənlər xətaya düşmüşlər. Onlar lüğəti tərəfə etimad edib şərri təriflər verirlər. Onların bu şübhələrinə rədd qaytarmışdır.

Əhli Sünnə alimləri deyirlər ki, tərif – ***Cəmiyən*** – toplayan və ***Məniyən*** – qoymayan olmalıdır. Tərif o, sözləri əhatə etməli və artıq sözlərin ora daxil olmasını qoymamalıdır. Tərif də nə qədər qısa və əhatəli olarsa dəyəri də bir o, qədər çox olar. Ən güclü tərif sayılar. Nə qədər ki, sözlər çox olarsa tərifin dəyəri də bir o, qədər aşağı düşər. Bir şey haqqında tərif verilərsə o, cümlədə işlədilən hər söz nəyəsə dəlalət edir. Yəni bu sözlərin heç biri əbəs yerə orada işlədilməmişdir. Məs: ***Səhabə*** – sözünün tərifi belədir: «Kim Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – i iman etdiyi halda görərsə və iman üzərə (müsəlman olaraq) ölərsə o, səhabədir. Ərəbcədən tərcümə etdikdə belədir. Hər bir sözü açıqladıqda – ***Kim*** – kimə deyilir? Ağıllı insana, insan olmalıdır. Heyvan görərsə səhabə sayılmır. ***Görərsə*** – əgər eşitsə səhabə deyildir. ***Iman Gətirdiyi Halda*** – əgər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – i görəndə kafir idi isə öləndə İslamı qəbul edirsə səhabə sayılır. ***Iman Üzərində Olaraq Ölərsə*** – əgər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – i iman üzərində görübsə, lakin öləndə dindən çıxıbsa səhabə sayılmır.

## İMANIN LÜĞƏTİ MƏNASI

Yuxarıda qeyd etdiyimiz kimi Əhli Sünnəyə müxalif olanlar qeyd edirlər ki, imanın lüğəti mənası tək təsdiqdir. Təsdiq və iman sinonim sözlərdir. Aralarında heç bir fərq yoxdur. Əhli Sünnə alimləri isə qeyd edirlər ki, imanın mənası təsdiqdir. Lakin təsdiqlə yanaşı başqa mənaları da vardır. İman sözü iki şeyi əhatə edir deyənlərin dəlillərindən birincisi ***İştiqaq*** – alınmaq deməkdir. Sözün kökü - iman sözü ***Əmin*** – sözündən alınmışdır. ***Əmənə***, ***Əminu***, ***Yuminu***, ***İmənən*** – sözünün məsdəridir. Qorxunun ziddidir. ***«Allah onları qorxudan əmin etdi»*** *(Qureyş 4).* İmana tək təsdiq mənasını vermək düzgün deyildir. Təsdiqlə yanaşı başqa bir şey, söz (məna da) vardır ki, bu da əmin olmaqdır. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «İman sözü əmin olmaqdır». ***«İndi biz doğru danışsaq da sən bizə iman etməyəcəksən».*** *(Yusif 17).* Yəqub – *əleyhissəlam* – onların sözlərinə əmin deyildir. Yəni sən bizim xəbərmizə arxayın deyilsən, etibar etmirsən biz sadiq olsaq da belə. Onlar Yəqub – *əleyhissəlam* – ın yanında etibarlı deyildirlər.

İman sözü iki şeyi əhatə edir deyənlərin dəlillərindən ikincisi isə ***İstiməl*** – sözünün işlənməsi, dilçilərin, ərəb dilində güclü olan alimlər imana elə bir təfsir vermişlər ki, özündə həm təsdiqi, həm də əmin olmağı əhatə edir. Tək təsdiqlə kifayətlənməmişlər. Dilçilərin bu sözləri başqalarına rəddir. O, kəslərə ki, iman tək təsdiqdir demişlər.

Dilçilər də bu fikirdədirlər ki, iman sözü həm təsdiqi, həm də əmin olmağı əhatə edir. «Lisanul Ərəb» kitabını yazan İbn Mənzur – *rahmətullahi aleyhi* – deyir ki, iman ***Siqadır*** (arxayın olmaq, inanmaq) deməkdir. ***Siqa*** – ərəb dilində əmin olmaq, arxayın olmaq mənasını verir. Sən bir şəxsə heç vaxt arxayın olmazsan əgər onu təsdiq etməsən. Bəzən görürsən ki, insan təsdiq edir lakin ona arxayın olmur. ***Siqa*** – sözü isə arxayınçılıqdır. Əgər təsdiq edəndən sonra əmin olarsa bu iman olur. Əgər insan xəbəri eşidib təsdiq edərsə, xəbər verən insana arxayın olarsa, xəbərin tələb etdiyini yerinə yetirərsə bu imandır. Əgər xəbəri təsdiq edib sonra xəbər verənə qarşı düşmənçilik edərsə bu iman sayılmaz. Bunlara ***Musaddiqlər*** – yalnız təsdiq edənlər deyilir.

Ümumən bunların dəlillərinin xülasəsi odur ki, iman məsələsində insan xəbər verənə arxayın olmalıdır, xəbərinə inanmalıdır və özünün də doğru olduğuna etiqad

etməlidir. Buna görə də imanın təfsirinə münasib ləfz gətirmək üçün buna dəlillər gətirmək lazımdır ki, daha da güclənsin. Buna da Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in əmisi Əbu Talibi misal göstərmək olar. Çünki o, Peyğəmbər – *sallallahu aleyhi və səllə* i təsdiq edirdi. Elə bir təsdiq ki, onda heç bir şəkk yox idi. Şair deyir ki, artıq onlar bildilər ki, bizim oğlumuz bizim yanımızda təqzib olunmazdır. Buna görə də batil sözlərə məhəl qoyulmaz. Onlar bilmirlər ki, biz Muhəmmədi Musa – *əleyhissəlam* – kimi tapdıq (Peyğəmbər kimi). Hansı ki, bu da əvvəlki kitablarda yazılmışdır. Bununla da belə ona mömin deyilməz. Çünki onun qəlbi İslamla rahatlıq tapmadı. İslama boyun əymədi. Səid b. Musəyyibin atası deyir ki, Əbu Talib ölüm anında ikən Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – onun yanına gəldi. Onun yanında Əbu Cəhl ilə Abdullah b. Əbu Umeyyə b. Muğirə də var idi. Peyğəmbər - *sallallahu aleyhi və səlləmm* – buyurdu: «Ey əmi! ***Lə İləhə İlləllah*** **–** kəlməsini de ki, bununla Allah yanında sənin lehinə şəhadət edim». Əbu Cəhl və Abdullah b. Əbu Umeyyə b. Muğirə də: «Ya Əbu Talib! AbdulMuttalibin millətini tərk mi edirsən?» dedilər. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – sözünü əmisinə deməkdə davam edirdi. Onlar da öz sözlərini deməkdə davam edirdilər. Nəhayət Əbu Talibin onlara söylədiyi son söz: «AbudulMuttalibin milləti üzərindəyəm!» oldu və: «***Lə İləhə İlləllah***» deməkdən çəkindi. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yaxşı bil ki, Allaha and olsun ki, qadağan olunanadək sənin üçün Allahdan bağışlanma diləyəcəyəm». Bundan sonra Allah ayə nazil etdi: ***«Müşriklərin Cəhənnəmlik olduqları*** *(müsəlmanlara)* ***bəlli olduqdan sonra, onlarla qohum olsalar belə, Peyğəmbərə və iman gətirənlərə onlar üçün bağışlanma diləmək yaraşmaz».*** *(ət-Tövbə 113).* ***«****(Ya Muhəmməd!)* ***Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən. Amma Allah dilədiyini doğru yola salar. Doğru yolda olacaq kəsləri*** *(öz əzəli elmi ilə)* ***daha yaxşı o bilir».*** *(əl-Qəsəs 56).* Başqa rəvayətdə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ey əmi! ***Lə İləhə İlləllah*** **–** kəlməsini de ki, bununla Allah yanında sənin lehinə şəhadət edim». Əbu Talib: «Qureyşin məni ayıblaması və haqqımda: «Əbu Talib bunu ancaq qorxudan dedi!» deməlari olmasaydı, onu deyib səni məmnun edərdim» . Əgər iman tək təsdiq olsa, onda onların sözlərindən belə çıxır ki, Əbu Talib mömindir. Buna görə də onlar bu sözləri ilə xətaya düşürlər. İmanın həm lüğəti, həm də istilahi (şərri) mansını tək təsdiqdir dediklərinə görə. Əbu Talib ***Musaddiq*** – tək təsdiq edən idi. Qureyşlilərin əksəriyyətinin halı da belə idi. ***«Bilirik ki, onların*** *(Quran barəsində)* ***dedikləri söz səni çox kədərləndirir. Həqiqətdə isə onlar səni yalançı hesab etmirlər*** *(ürəklərində sənin həqiqi Peyğəmbər olduğunu yaxşı bilirlər).* ***Ancaq o, zalimlər*** *(müşriklər)* ***Allahın ayələrini inadla inkar edirlər»*** *(əl-Ənam 33).* Həmçinin Yəhudilərin halı da belə idi. ***«Kitab*** *(Tövrat və İncil)* ***verdiyimiz şəxslər onu*** *(Muhəmmədi)* ***öz oğullarını tanıdıqları kimi tanıyırlar.*** *(Buna baxmayaraq)* ***onların bir qismi şübhəsiz ki, həqiqəti bilə-bilə gizlədir».*** *(əl-Bəqərə 146).* Təkcə təsdiq etmək onların mömin olması demək deyildir.

Səhih iman düzgün iman sahibinə əmanəti qorumağa yönəldir və xəyanətdən çəkindirir. Hətta insanlar onun barəsində əmin olurlar. Ən qiymətli şeylərində belə o, insana əmin olurlar. Qiymətli şeylər də qanları və mallarıdır. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mömin o, şəxsdir ki, başqa insanlar ondan əmindirlər. Canlarında və mallarında» .

[525] Müslim.
[526] Tirmizi 2627, Nəsai 8/104,105, Əhməd 2/379, İbn Məcə 3934, əl-Albani «Səhihul Cəmi» 6710.

Kamil imanın tələb etdiyi şeylərdəndir ki, həmçinin də imanın səmərələrindəndir ki, mömin tərəfindən insanlara qarşı heç bir pislik, əziyyət verilməz. Bu kimi şeylərdə həddi aşmaq əmin-amanlığa xələl gətirir. Bu da imanın kamilliyinə xələl gətirir. Kamil iman isə sahibini həddi aşmaqdan insanlara qarşı təcavüz etməkdən onların mallarına, canlarına və malik olduqları şeylərə qarşı təcavüz etməkdən çəkindirir. İnsanın imanı nə qədər artarsa bir o, qədər də insanda o, sifət: «Nədir o, sifət? – Başqa insanların ondan əmin, arxayın olmaları!» yaranar. İnsanın imanı artdıqca mömindən başqalarına əziyyət toxunmur. Buna görə də iman əhlinin söylədiyi şüar «***Əssələmu Aleykum***» - dur. Deməli insanın söylədiyi ilk söz və eşidənin də eşitdiyi ilk söz salamatçılıqdır. O, salam söyləyən insan söylədiyinə qarşı heç bir şər və pis niyyət daşımır. Həmçinin xəyanət və məkrdə. Sənə salamtçılıqla dua edən və sənə bu salamı verən sənə qarşı heç həddi aşarmı. Yəni məndən sizə qarşı heç bir xələl gəlməz. İman tam bir əmin-amanlığın olmasını tələb edir. Mömin tərəfindən qardaşına və bütün insanlara qarşı. Çünkü o, mömindir imanı qəlbində kamilləşib. Artıq imanın şöbələri də kamilləşib. Əgər belə bir xislətlər bir kimsədə hasil olarsa insanlra qarşı həddi aşmaq, oğurluq, mallarına təcavüz etmək imanın zəifləməsini göstərir. Belə bir kimsə kamil mömin deyildir. Çünki Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – kamil mömini vəsf edərək buyurdu ki: «Mömin o, şəxsdir ki, başqa insanlar ondan əmindirlər».

İmanın mənalarından biri də ***Təsdiq*** - etmək deməkdir. Təqzibin, yalanın ziddidir. Rəbb olaraq Allaha iman etdim. ***«Biz Allaha iman etdik deyin»*** *(əl-Bəqərə 136).* ***«İndi biz doğru danışsaq da sən bizə iman*** *(yəni təsdiq)* ***etməyəcəksən.*** *(Yusif 17).* ***«Sənə ən rəzil*** *(səfil, yoxsul)* ***adamlar tabe olmuşkən, biz sənə imanmı gətirəcəyik?».*** *(əş-Şuəra 111).* ***«Bunların tayfası bizə bir qul kimi itaət etdiyi halda biz özümüz kimi iki adi insana imanmı gətirəcəyik?».*** *(əl-Muminun 47).* İman qəti olaraq təsdiqdir. Tam bir etirafdır. Allah və Rəsulunun əmr etdiyi hər bir şeyi qəti olaraq təsdiq etmək, tam bir şəkildə etiraf etmək və ona zahirən və batinən də boyun əyməkdir (buna ***İnqiyad*** deyi-lir). Allahın əmr etdiyi hər bir şey itaətdir. İman nədir? İtaətdir. İtaətdə əmrə müvafiq olmaqdır. Əgər əməl əmrə müvafiqdirsə o, itaət sayılır. Əgər əməl əmrə müvafiq deyilsə itaət sayılmır. Buna görə də Allah və Rəsulunun əmr etdiyi hər bir şey itaətdir. İtaətdə imandır. Hamısıda din sayılır. Təsdiqdən sonra insan zahirən da, batinən da boyun əyməlidir. İnqiyad batinən də insanın qəbul etməsidir. Etiqad etmək və bundan doğan əməllərə, qəlbi əməllərə etiqad etməkdir. Zahiri əməllərə boyun əymək, dil və əzalarla əməlləri yerinə yetirməkdir. İman qəlbin təsdiqi və qəlbin etiqadıdır. Elə bir etiqad ki, həm qəlb əməllərini həm də bədən əməllərini özündə əhatə edib. Bu da bütün dini yerinə yetirməyi əhatə edir. Burada olan etiqad ya əməlləri özündə əhatə edir, ya da bu əməlləri tələb edir. Bununla da kamil iman qəsd olunur. Elə bir etiqad ki, həm qəlb həm də bədən əməllərini tələb edir. Kamil imanda artıq bütün əməllərə riayət olunur. Çünki kamil iman bütün zahiri və batini ibadətləri, əməlləri əhatə edir. Çünki sən etiqad etdikdə artıq bu etiqad səndən bu əməlləri tələb edir. İmanın əsası da imanın kamilliyini tələb edir. Bu da zahiri və batini əməlləri tələb edir.

***İqrar*** – sözü qəlbin iqrarı və rahat olması üçün imanın mənasında olduqca mühümdür. Amma təsdiq edib sonra müxalif olmağı qəlbində qəti olaraq keçirən şəxs iman gətirmiş sayılmaz. Hətta təsdiq etsə də belə. Onda imanın təfsiri üçün daha münasib kəlimə hansıdır. İmanın lüğət tərəfdən təfsiri üçün ən münasib kəlimə iqrar kəliməsidir. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki, bəlli olduğuna görə iqrar – imandır. Sadəcə təsdiq demək deyildir. Ərəb dilində iqrar təsdiqdən də daha geniş

mənanı əhatə edir. İqrar qəlbin sözunu əhatə edir. Hansı ki, o da təsdiqdir. Buradan da aydın olur ki, təsdiq qəlbin sözüdür. Deməli iqrar həm qəlbin sözünü əhatə edir, həm də qəlbin əməlini. O, da ***İnqiyad*** – boyun əyməkdir. Bunula da lüğət tərəfdən imanın mənası daha da həqiqətə uyğun olur. İqrar da iki şeyi özündə əhatə edir ki, birincisi qəlbin sözüdür. O, da təsdiqdir. Təsdiq də xəbərin düzgünlüyünü və xəbər verənin də doğruluğunu təsdiq etməkdir. Bu da iman mövzusunda olduqca mühümdür. Bəzən etiqad edir ki, xəbər səhihdir, xəbər verən isə yalançıdır. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – Ramazan ayında (fitrə) zəkatını qorumağı mənə əmr etmişdi. Bir gecə (tanımadığım) biri gələrək bu zəkatı ovuclamağa başladı. Dərhal onu yaxalayaraq: «Səni Rəsulullah - *sallallahu aleyhi və səlləm* – in yanına aparacağam» dedim. O: «Mən ehtiyac sahibiyəm. Üzərimdə baxmaqla yükümlü olduğum uşaqlarım vardır. Ağır ehtiyac içindəyəm» dedi. Mən də yazığım gələrək onu buraxdım. Səhəri Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ilə görüşdükdə: «Ya Əbu Hureyrə! Dünən gecəki əsirin nə etdi?» deyə buyurdu. Mən: «Ya Rəsulullah! Ehtiyaclı olduğundan və çox uşaqlı olduğundan şikayət etdi. Mənim də ona yazığım gəldiyi üçün onu buraxdım» dedim. Peyğəmbər: «Diqqətli ol! O, sənə yalan söyləmişdir və yenə də sənin yanına gələcəkdir» deyə buyurdu. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – əvvəlcədən mənə xəbər verdiyi üçün onu gözləməyə başladım. (Bir müddətdən sonra) həqiqətən də o, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in xəbər verdiyi kimi gəldi və zəkat malını ovuclamğa başladı. Mən (yenə də) onu tutaraq: «Səni Rəsulullah - *sallallahu aleyhi və səlləm* – in yanına aparacağam» dedim. O: «Yenə də göz yaşı tökərək ehtiyaclı, çox uşaqlı olduğunu söyləməyə başladı və bir daha gəlməyəcəyini söylədi». Mən yenə də yazığım gələrək onu buraxdım. Səhəri Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ilə görüşdükdə: «Ya Əbu Hureyrə! Dünənki əsirin nə etdi?» deyə buyurdu. Mən: «Ya Rəsulullah! Yenə də ehtiyaclı olduğundan və çox uşaqlı olduğundan şikayət etdi. Mənim də ona yazığım gəldiyi üçün onu buraxdım» dedim. Peyğəmbər: «O, sənə yenə də yalan söyləmişdir. Lakin onu gözlə yenə də gələcəkdir» deyə buyurdu. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – bu sözlərindən sonra mən onu üçüncü dəfə gözləməyə başladım. (Bir müddətdən sonra) o, gələrək zəkat malını ovuclamğa başladı. Bu dəfə onu möhkəmcə yaxaladım və bu dəfə sənu mütləq Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in yanına aparacağam. O: «Burax məni! Sənə bir neçə kəlimə öyrədərəm ki, Allah bu kəlimələr sayəsində səni faydalandırar» dedi. Mən: «Bu (nə sözlərdir)» dedim. O: «Yatağına girdiyin zaman «Ayətul Kursi – Bəqrərə **255**-ci ayəsini» başlanğıcdan sonuna qədər oxusan, bu vaxtı səhərə qədər səninlə Uca Allah tərəfindən səni qoruyan bir mələk yanından ayrılmaz. Şeytan isə səhərə qədər sənə yaxınlaşa bilməz» dedi. Mən də bu sözlərdən sonra onu buraxdım. Səhəri Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ilə görüşdükdə: «Ya Əbu Hureyrə! Dünən gecəki əsirin nə etdi?» deyə buyurdu. Mən: «Ya Rəsulullah! Mənə sayəsində Allahın mənə fayda verəcək bir neçə kəlimə öyrətdi. Mən də onu buraxdım» dedim. Peyğəmbər: «Bu nə kəlimələrdir belə?» deyə buyurdu. Mən: «Mənə yatağına girdiyin zaman Ayətul Kursini başdan sona qədər oxu dedi. Və bu vaxtı səhərə qədər Allah tərəfindən olan gözətçi mələk sənin yanından ayrılmaz və şeytan sənə yaxınlaşa bilməz» dedi. Peyğəmbər: «Həqiqətən o, sənə doğrunu söyləmişdir. Halbuki o, özü yalançıdır. Ya Əbu Hureyrə! Üç gündür kiminlə söhbət etdiyini bilirsənmi?» deyə buyurdu. Mən: «Xeyr, bilmirəm»

dedim. Peyğəmbər: «O, şeytan idi» deyə buyurdu . Bu iman məsələsində xəbər verənə insan arxayın olmalıdır. Onada və onun verdiyi xəbərin doğru olduğuna da.

İkincisi isə qəlbin əməlidir. O, da qəlb tərəfdən artıq arxayın olmaq və əzm – qəti qərar vermək ki, buna (xəbərin tələb etdiyinə) boyun əyəcəkdir. Ona müxalif olmayacaq və ikrah hissi ilə ona yanaşmayacaqdır. İman iqrardır. İqrar da özündə əhatə edir təsdiqi, qəlbin rahatçılığını və qəlbin əmin olmasını. İqrarın mənası ilə imanın lüğətdə olan mənası nə kimi müvaffiqlik vardır. Əgər biz biləndə ki, iqrar sözü dildə iman sözünün təşkil etdiyini təşkil edir, əhatə etdiyini də əhatə edirsə bununla aydın olur ki, imanın təfsiri üçün ən münasib kəlimə iqrar sözüdür.

Onun mənalarından biri də dildə ***Səbət*** - sabitlik, ***Əmənə*** - əmin olmaq, ***İstiqrar*** - yerləşmək və ***Dumənin*ə** - arxayın olmaq deməkdir. ***Qarra*** – mənasında ***Qarra, Yəqirru, Əuyəqarru, Qararan İzə Səbətən, Sumutan, Cəmitən*** – donaraq sabit qalarsa. Buna görə də iman da insanın qəlbində sabit olur və möhkəmlənir. Şair deyir ki: «***Və Lə Qarara Alə Zəli Minəl Əsədi***» - «Səs çıxaran şirin yanında əmin olmaq mümkün deyildir». Burada olan əmin sözü «***Və Lə Qarar***» sözü ilə işlədildi. İnsan belə bir aslanın yanında rahatlaşa, əmin ola bilməz. İqrarın mənasından biri də bir şeyi sabit etmək, isbat etməkdir. ***«İstədiyimizi ana bətnində müəyyən bir müddət*** *(adətən doqquz ay)* ***saxlayar, sonra sizi*** *(oradan)* ***uşaq olaraq*** *(doğurub)* ***çıxardarıq».*** *(əl-Həcc 5).* Bu isbat bəzən qəlb tərəfdən olur, bəzən də dillə. Ya da hər ikisi ilə birlikdə olur. Tövhidin isbatına gəldikdə isə tək dil kifayət deyildir. Buna mütləq qəlbin də iqrarı, təsdiqi olmalıdır.

İqrar inkarın əksidir. Çünki iqrar ilə inkar təsdiqdə bəzən şərik olur. Görürsən ki, insan bəzən təsdiq də edir, iqrar da, etiraf da edir, qəbul da. Bəzən də təsdiq edir, inkar da edir. ***«Xatırlayın ki, yenə bir zaman sizinlə: «Bir-birinizin qanını tökməyin, bir-birinizi yurdlarınızdan çıxarmayın!» deyə razılığa gəldik. Sonra siz həmən əhd-peymanın şahidi olub onu təsdiq etdiniz».*** *(əl-Bəqərə 84). «(Ey Kitab əhli!)* ***O, vaxtı yadınıza gətirin ki, Allah Peyğəmbərlərdən: «Sizə verdiyim kitab və bilikdən sonra, sizdə olanı təsdiq edən bir Peyğəmbər gəldikdə ona mütləq inanıb yardım edəcəksiniz» – deyə əhd almış və onlara: «Bunu təsdiq edib, ağır olan əhdimi qəbul etdinizmi?» - demişdi. Onlar da: təsdiq etdik» – deyə cavab vermişdilər.*** *(Bu zaman)* ***Allah: «Elə isə*** *(bir-birinizə)* ***şahid olun! Mən də sizinlə bərabər şahidlərdənəm» – deyə buyurmuşdur».*** *(Ali İmran 81).* Allah bu ayələrdə iman gətirir sözünü – iqrar sözü ilə işlətmişdir.

Həmçinin İqrar kəliməsi əhd-peymanda deməkdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bizim ilə onların arasında əhd namazdır. Kim onu tərk edərsə küfrə (şirkə) düşmüş olar» . Bu məsələnin xülasəsi ondadır ki, iman ləfzini tək təsdiqlə təfsir vermək kifayət deyildir. Elə bir kəlimə seçmək lazımdır ki, o kəlimə özündə həm təsdiqi, həm də əmin olmağı əhatə etsin. Bu da iqrar kəliməsidir.

## İMANIN İSTİLAHİ (ŞƏRİ) MƏNASI

---

[527]Buxari 5010.

[528] Əhməd 5/346,355, Tirmizi 2621, Nəsai 1/231-232, İbn Məcə 1079, İbn Əbi Şeybə «əl-Musənnəf» 30387, İbn Hibban «əl-İhsan» 1454, Darakutni 1733, Beyhəqi «Sünnən Kubra» 3/366, «Şuabul İman» səh. 43 və s. Bureydə b. əl-Husayb əl-Əsləm - *radıyallahu anhu* – dan. əl-Albani «Səhihut Tərğib» 561, «Səhihul Cəmius Səğir» 4143, «Mişkətul Məsabih» 574.

İmanın tərifinə və təfsirinə gəldikdə isə iman qətiyyətli bir təsdiqdən, tam bir etirafdan, Allah və Rəsulunun inanmağı əmr etdiy hər bir şeyi etiraf etmək və qətiyyətlə təsdiq etmək, zahirdə və batində boyun əyməkdir. Bu da qəlbin təsdiqi və etiqadıdır. Özündə qəlbin və bədənin əməllərini əhatə edir. Bu da bütün dini yerinə yetirməyi əhatə edir. Buna görə də Sələflər deyirlər ki, iman dilin və qəlbin sözüdür. Dilin sözü Şəhadət Kəliməsidir ki, insanın İslam dininə girməsini elan edir. Qəlbin sözü isə təsdiqdir. Çünki insan Şəhadət Kəliməsini dili ilə söylədikdə qəlbi deyir ki, ***Saddəqtu*** – mən təsdiq etdim və bunu qəbul edir. Həmçinin də qəlbin və əzaların əməlidir ki, buradan da qəsd olunan qəlbin, dilin və bədən üzvülərinin əməlidir. İtaətlə artar, asiliklə azalar. İbn Qeyyim - *rahmətullahi aleyhi* - deyir ki: «İmanın həqiqəti söz və əməldir. Söz iki qisimdir. Qəlbin sözü – bu etiqaddır. Dilin sözü – bu isə Tövhid kəliməsini söyləməkdir. Əməl də iki qisimdir. Qəlbin əməli – bu niyyət və ixlasdır və əzaların əməli. Bu dördü olmadığı zaman iman kamiliyyə çatmaz. Qəlbin təsdiqi olmadığ zaman qalan qisimlərin də faydası olmaz» . İmam Şafii - *rahmətullahi aleyhi* - deyir ki, iman söz və əməldir. Artar və əskilər. İtaətlə artar, günahlarla azalar və bu ayəni oxudu. ***«İman edənlərin imanı artsın deyə»*** **.** Əbu Hənifə – *rahmətullahi aleyhi* – yə görə: «İman – dil ilə iqrar, qəlb ilə təsdiqdir» . İqrar tək başına iman olmaz. Çünki iqrar sadəcə iman olsaydı, bütün münafiqlər mömin olardılar. Yenə eyni şəkildə təsdiq də tək başına iman olmaz. Çünki sadəcə təsdiq iman olsaydı, Əhli-Kitab (Yəhudi və Xristianlar) mömin olardılar» . Fudeyl b. İyad - *rahmətullahi aleyhi* - deyir ki: «Bizə görə imanın içi də çölü də dil ilə iqrar, qəlb ilə söyləmək və onunla əməl etməkdir» . İmam Buxari - *rahmətullahi aleyhi* - deyir ki: «Mindən çox alimdən elm yazdım. Kimdən yazdımsa hər birisi iman söz və əməldir dedilər. Heç kimdən iman sözdür deyə bir şey eşitmədim» . Əbu Zura ər-Razi - *rahmətullahi aleyhi* - deyir ki: «Bizə görə iman söz və əməldir. Artar və əskilər. Kim bundan başqa bir söz söyləyərsə o, bidətçidir və murciyədəndir» . əs-Səfərani – *rahmətullahi aleyhi* – deyir ki: «Hədis və Sələf alimlərinin qəbul etdikləri görüş iman qəlb ilə təsdiq, dil ilə iqrar və rükunları ilə əməl etməkdir. İtaətlə artar, günahlarla azalar. Əksi təqdirdə dil ilə iqrar olmadan sadəcə qəlb ilə təsdiqlə iman hasil olmaz. Bu səbəblə də İblis Allahın varlığını və rububiyyətini təsdiq etsə belə mömin deyə isimləndirilməz» . İbn Battal - *rahmətullahi aleyhi* - deyir ki: «İman söz etibarı ilə təsdiqdən ibarətdir - deyiləcək olursa, buna cavabımız budur: Təsdiq bütün itaətləri yerinə yetirməklə kamil olur. Mömin xeyirli əməllərini çoxaltdıqca imanı daha da kamilləşir. Bunlarla birlikdə iman da artır. Xeyirli əməllər əskildi mi imanın kamilliyi də əskilir. İman haqqında ən mötədil rəy də budur» . İbn AbdurRazzaq deyir ki: «Mən keçmiş nəsil və elm sahiblərindən Sufyən əs-Səvri, Məlik b. Ənəs, Ubeydullah b. Ömər, əl-Əvzai, Mamər b. Rəşid, İbn Cureyc, Sufyən b. Uyeynənin belə dediklərini dinlədim: «İman, söz və əməldir, artar və əskilər. Eyni zamanda İbn Məsud, Xuzeyfə, ən-Nəhai, Həsənul Bəsri,

---

[529] İbn Qeyyim «Kitabus Salah və Hukmu Tarikiha» s. 54.
[530] «Fəthul-Bəri» 1/62, «İman kitabı».
[531] Fikhul Əkbər s. 62.
[532] əl-Vəsiyyə s. 72.
[533] əl-Lələkai «Şərhu Üsulu Etiqadi Əhli-Sünnə Vəl Cəmaat» 4/932 (1590).
[534] əl-Hallal «Sunnə» 3/579 (1002).
[535] İbn Rəcəb Hənbəli «Tabaqatul Hənbəliyə» 1/203.
[536] əs-Səfərani «Şərhu Sulasiyyatı Musnədi İmam Əhmədi» 2/218.
[537] Müslimin şərhi 1/124.

Tavus, Mücahid və Abdullah b. Mubərəkin də yekdil rəyləridir» . İmam Buxari – *rahmətullahi aleyhi* – deyir ki: «Hicazlı, Məkkəli, Mədinəli, Bəsrəli, Kufəli, Bağdadlı, Şamlı, Misirli min insandan daha çox elm adamları ilə dəfələrlə görüşdüm. Onlardan heç birinin iman söz və əməldir xüsusunda ixtilaf eətdiyini görmədim . İmam əl-Acurri - *rahmətullahi aleyhi* - deyir ki: «Allah sizə və bizə rəhmət etsin. Biliniz ki, müsəlman alimlərin üzərində icma etdikləri şeyə görə iman bütün insanlara fərzdir. O, qəlb ilə təsdiq, dil ilə iqrar, orqanlarla əməl etməkdir. Sonra biliniz ki, dilin söyləməsi olmadıqca sadəcə qəlb ilə bilmək və təsdiq etmək yetərli deyildir. Orqanlarla da əməl etmək olmadıqca da qəlb ilə bilmək və dil ilə söyləmək yetərli deyildir. Bu üç hislət bir kimsədə tamam olduğu zaman mömin olur. Quran, Sünnət və müsəlman alimlərinin görüşləri buna dəlalət edir (Başqa rəvayətdə: «Əməllərlə təsdiq etməyən, qəlb ilə təsdiq edib və dil ilə söyləməyi yetərli görən kimsə mömin olmaz. Bilmək və söyləmək ona fayda verməz. Əməli tərk etməsi imanını yalanlaması deməkdir. Zikr etdiyimiz əməlləri etmək isə (namaz, oruc və s) imanın doğrulması deməkdir)» . Əli – *radıyallahu anhu* – deyir ki: «İman qəlbdə ağ bir nöqtə kimi başlayır, iman artdıqda o, ağ nöqtə də artır» . Digər bir rəvayətdə isə Əli – *radıyallahu anhu* – deyir: «Səbrin imana görə durumu, başın bədənə görə durumudur. Səbri olmayanın imanı da olmaz» . İbn Məsud – *radıyallahu anhu* – dua edərək deyir ki: «Allahım! İmanımızı, yəqinliyimizi və fiqhimizi artır!». ***Allahummə Zidni, Ilmən, Yəqinən Və Fikhən*** . Ömər – *radıyallahu anhu* – səhabələrə: «Gəlin imanımızı artıraq!» - deyərək, Allahı zikir edərdilər» . Əbu Hureyrə – *radıyallahu anhu* – deyir ki: «İman pisliklə (günhlarla) bir yerdə uyğunlaşmaz. Kim zina edərsə iman ondan ayrılar. Lakin nəfsini qınayar və doğruya dönərsə iman da ona dönər» . Əbu Darda – *radıyallahu anhu* – deyir ki: «İman ancaq sizdən hər hansı bir kimsənin bir dəfə geydiyi sonra isə çıxardığı bir köynəyə bənzəyir. Allaha and olsun ki, bir qul öz imanında özünü əminiyyətdə (arxayınçılıqda) hiss edərsə mütləq imanın alındığını görür və onun yoxluğunu hiss edir» . Cündub b. Abdullah əl-Bəcəli – *radıyallahu anhu* – deyir ki: «Biz Quranı öyrənməkdən əvvəl imanı öyrəndik. Sonra Quranı öyrəndik və onunla imanımızı artırdıq» . Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, İman təmiz və pakdır. Hər kim zina edərsə iman ondan ayrılar. O, kimsə nəfsini qınayaraq tövbə edərsə iman da ona geri dönər» . Umeyr b. Həbib əl-Hutami – *radıyallahu anhu* – deyir ki: «İman artar və əskilər. Deyildi ki, onun artması və əskilməsi nədir? Dedi ki: «Allahı zikr etdiyimiz və Ona həmd etdiyimiz zaman bu imanın artmasıdır. Qəflət etdiyim və unutduğumuz zaman bu imanın azalmasıdır» . Ammar b. Yəsir – *radıyallahu anhu* – deyir ki: «Üç şey vardır ki, bunları bir yerdə toplayan imanı da toplamış olar: «Nəfsinə ədalətli davranmaq, hərkəsə salam vermək, kasıbçılıqda xərcləmək» . Abdullah b. əl-

---

[538] Müslimin şərhi 1/125.
[539] əl-Laləkai «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Cəmaat».
[540] əl-Acurri «Kitabu Şəriyyə» 2/611-614 Darul Vətən.
[541] İbn Teymiyyə «Kitabul İman» s.90.
[542] Bax: 35-ə.
[543] Bax: 35-ə.
[544] İbn Əbi Şeybə «İman» 108, «əl-Musənnəf» 11/26.
[545] əl-Laləkai «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Cəmaat».
[546] əl-Laləkai «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Cəmaat».
[547] əl-Albani Səhih Sünnən ibn Məcə 1/16.
[548] əl-Acurri «Kitabuş Şəria» 2/596 – təhqiq Abdullah əd-Dəmici «Darul Vətən».
[549] İbn Batta 2/845 (1131).
[550] Buxari.

Humeydi – *rahmətullahi aleyhi* – deyir ki: «İman söz və əməldir, artar və əskilər» . İmam Əhməd – *rahmətullahi aleyhi* – dən Murciyəlilərə aid sual soruşulduqda belə cavab vermişdir: «Bizlər deyirik ki, iman söz və əməldir. Artar və əskilər» . Buna görədir ki, Bəkr b. Abdullah əl-Muzni – *rahmətullahi aleyhi* – deyir: «Əbu Bəkr – *radıyallahu anhu* – namaz və orucları ilə sizi qabaqlamayıb. O sizi onun qəlbində olan imanla qabaqlayıb». İbn Abbas, Əbu Hureyrə, Əbu Dərda – *radıyallahu anhum* – deyirlər ki, iman həm artır, həm də azalır . İmam Vəki b. əl-Cərrah - *rahmətullahi aleyhi* - deyir ki, Əhli Sünnə deyir ki, iman söz və əməldir . İmam Əhməd - *rahmətullahi aleyhi* - deyir ki, iman artar və azalar. Artması əməl ilə, azalması isə əməli tərk etməklədir . Onlar deyirlər ki, iman söz və əməldir. Bununla yanaşı qəlbin söz və əməlini qeyd etmirlər. Çünki qəlbin etiqadına, qəlbdə olan imana Əhli Sünnədən heç kəs etiraz etməyib. Hamı müttəfiqdirlər ki, iman qəlbdə olur. İxtilaf isə söz və əməldədir. Buna görə də sələflər qəlbin söz və əməlini qeyd etməyiblər.

Sələflər deyirlər ki: "İman qəlbin etiqadı, dilin sözü və bədən üzvülərinin əməlidir . İtaətlə artır və asiliklə azalır". Bu tərifi dedikdə onlar nə qəsd edirlər? Onlar bununla kamil imanı qəsd edirlər. Bu iman sayəsində insan Allahın dosluğuna nail olur. Müttəqilərdən olur. Başlanğıcdan Cənnətə girənlərdən olur. Bu iman sayəsində bütün kəramətlər əldə olunur. İnsanın imanı kamil olmaz (imanın şöbələrini) elm və əməl tərəfdən kamilləşdirməsə. Xəlifə Ömər b. AbdulƏziz - *rahmətullahi aleyhi* - deyir ki: «İmanın fərzləri, hökmləri, sərhədləri və sünnətləri vardır. Kim bunları tam olaraq yerinə yetirərsə imanı kamil olmuş olar. Kim bunları tam olaraq yerinə yetirməzsə imanı da əskik olar» . İman kamil dərəcəsinə çata bilməz əgər insan bunları dil, qəlb və əməl tərəfdən kamilləşdirməsə. Kim də bunları naqisləşdirərsə artıq imanı da naqisləşər.

***İman Dillə Deyilən Sözdür*** – deyildikdə sələflərin qəsdi dillə olan bütün itaətlərin hamısı imandandır deməkdir. Onları yerinə yetirmək insanın imanını artırır və bütün bunlar iman adlanır. Məs: İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allahdan başqa ilah olmadığına və Məhəmmədin Allahın Rəsulu olduğuna şəhadət edincəyə, namaz qılıncaya, zəkat verincəyə qədər insanlarla vuruşmağa əmir olundum. Bunu etdilərmi, İslamın haqqı müstəsna olmaqla öz qanlarını və mallarını məndən qorumuş olurlar. Haqq-hesablarını çəkmək isə Allaha aiddir» . Bu mövzuda hədislər olduqca çoxdur. İnsan Şəhadət Kəliməsini dillə söyləyərsə artıq onun malı, qanı qorunur. İnsanın İslama girməsi üçün yetərli olan iman nitqlə söyləməsi ilə olmalıdır. Bu kəlimə də imandan bir hissədir və iman üçün bir şərtdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim ***Lə İləhə İlləllah*** deyib qəlbində arpa (buğda) dənəsi qədər iman (xeyir) olarsa Cəhənnəmdən çıxacaqdır» . Bu hədislər onu göstərir ki, insanın İslama girməsi və Cəhənnəmdən qurtulması üçün mənfəət verən iman üçün nitq lazımdır. Bu da dilin

---

[551] əl-Humeydi «Usuli Sünnə və ya Musnəd» 2/546.
[552] Abdullah b. Əhməd «Sünnə» 1/307.
[553] Bax: 35-ə.
[554] Bax: 35-ə.
[555] Bu rəvayətləri səhih sənədlərlə imam əl-Ləlakai «Şərhu Üsulu Etiqadi Əhli-Sünnə Vəl Cəmaat Minəl Kitəbi Vəs Sünnəti Və İcməi Səhəbəti Və-T Tabiin» əsərində qeyd edir.
[556] Lüğətdə ***Ə-M-N*** maddəsinə bax: Əzhəri «Təhzibul Luğat» c. 15 s. 523, İbn Mənzur «Lisanul Ərəb» c. 13 s. 21-27.
[557] Buxari.
[558] Buxari 25; Müslim 22.
[559] Buxari, Müslim.

əməlidir. Bundan başqa zikr etmək, Quran oxumaq, dua etmək, elm öyrənmək və öyrətmək, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ə salavat gətirmək, yaxşılığı əmr edib, pisdən çəkindirmək və s. dillə deyilən hər bir söz itaət adlanır. İtaət də iman adlanır.

***İman Qəlblə Etiqaddır*** – deyildikdə Sələflərin qəsdi qəlbdə olan bütün etiqadların hamısı imandır və iman adlanır. Qəlbdə olan itaətlərin möhkəmlənməsi ilə insanın imanı artır. Bu etiqadları insan nə qədər çox yerinə yetirərsə və kamilləşdirərsə iman da bir o, qədər artar və möhkəmlənər. Çünki qəlb imanın əsasıdır. Qəlbdə olan əməllər imanın əsası sayılır. Məs: Qəlbi iman – *«(Ya Muhəmməd!)* ***Ürəklərində inanmadıqları halda, dildə*** *(ağızları ilə)* ***inandıq – deyənlərin… Onlar elə kəslərdir ki, Allah onların ürəklərini təmizləmək istəməmişdir. Onları dünyada rüsvayçılıq, axirətdə isə böyük bir əzab gözləyir».*** *(əl-Maidə 41).* ***«Qəlbi imanla sabit olduğu halda*** *(küfr sözünü deməyə)* ***məcbur edilən*** *(dil ilə deyib ürəyində təsdiq etməyən)* ***şəxs istisna olmaqla, hər kəs iman gətirdikdən sonra küfr etsə*** *(onu ağır təhlükə gözləyir).* ***Qəlbən küfrə razı olanlara*** *(qəlbində könüllü surətdə küfrə yer verənlərə)* ***Allahın qəzəbi tutar və onlar şiddətli bir əzaba düçar olarlar»*** *(ən-Nəhl 106).* Birinci ayə dilləri ilə iman gətirib qəlbləri ilə iman gətirməyənlər barəsindədir. İkinci ayə isə qəlbi ilə iman gətirdiyi halda dili ilə məcbur edilərək küfr kəliməsini söyləyənlər barəsindədir. Lakin qəlbləri imanla rahatlıq tapır, imanla sabitləşir. Onlar möminlərdir. Sadəcə bu küfr sözünü söyləməkdə məcbur edilmişlər. Bu iki ayə ona dəlalət edir ki, qəlblər iman gətirir. İbrət də elə qəlbdədir. İnsanın əməllərinin ölçülməsi də qəlbdə olan imana görədir. İmanı tələffüz etmək iman sayılmır əgər qəlblə iman gətirməyibsə. Qəlbdə iman odur ki, insan qəlbi ilə etiraf edə, qəlbi ilə bilə, təsdiq edə və etiqad edə. İmanın əsası da qəlbdə olur.

***Bədəvi ərəblər: «Biz iman gətirdik!» dedilər.*** *(Ya Peyğəmbər! Onlara)* ***De ki: «Siz*** *(qəlbən)* ***iman gətirmədiniz! Ancaq: «Biz İslamı qəbul etdik!» deyin. Hələ iman qəlblərinizə daxil olmamışdır. Əgər Allah və Peyğəmbərinə itaət etsəniz O, sizin əməllərinizdən heç bir şeyi əskiltməz. Həqiqətən Allah bağışlayan və rəhm edəndir».*** *(əl-Hucurat 14).* Bədəvi ərəblər Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in yanına İslamı qəbul etmək üçün gəlmişdilər. Özlərinin təslim olduqlarını bildirmək üçün. Onlar da imanda təzə idilər. Lakin buna baxmayaraq kamillik iddia etdilər. İslamı addıyaraq: «Biz iman gətirdik» dedilər. Lakin Allah onların bu iddialarını inkar etdi. Allah onları onların durumlarına uyğun bir vəsfə, sifətə yönəltdi. Deyin ki, biz təslim olduq. Yəni Allaha təslim olmaqla İslama daxil olduq. Çünki siz imanın həqiqətinə, yüksək dərəcəsinə çatmamısınız. Lakin sizdə imandan bir pay vardır ki, onunla da siz müsəlman oldunuz. Bəziləri qeyd edirlər ki, bu ayədə qəsd olunanlar münafiqlər idi. Lakin bu səhf fikirdir. Çünki Allah özü onlara buyurur ki, deyin ki, təslim olduq. Heç vaxt zənn oluna bilməz ki, Allah onlara desin ki, deyin biz müsəlman olduq sonra da onlar müsəlman olmasınlar. Onlar da iman vardır. Hansı ki, onunla müsəlman olublar. Lakin imanın həqiqəti, kamilliyi yoxdur. Yəni onlar saleh əməl işləsələr bu onlardan qəbul olunar. Onlarda imanın əsası olduğu üçün. «Əgər Allah və Peyğəmbərinə itaət etsəniz O, sizin əməllərinizdən heç bir şeyi əskiltməz. Həqiqətən Allah bağışlayan və rəhm edəndir». Yəni yol sizin qarşınızda açıqdır ki, siz imanınızda daha da tərəqqiyə doğru gedəsiniz. Bundan sonra Allah onlara imanın həqiqətini bəyan edir. ***«Möminlər yalnız Allaha və Peyğəmbərinə iman gətirən və iman gətirdikdən sonra heç bir şəkk-şübhəyə düşməyənlərdir. Allah yolunda malları və canları ilə vuruşarlar. Məhz***

***belələri sadiq olanlardır».*** *(əl-Hucurat 15).* Bunlardan başqa imanın qəlbdə olmasına dəlil: ***«…Onlar elə kimsələrdir ki, Allah onların qəlblərinə iman yazmış və öz dərgahından onlara güc vermişdir*** *(iman, hidayət nuru əta etmişdir).* ***Allah onları*** *(ağacları)* ***altından çaylar axan Cənnətlərə daxil edəcəkdir. Onlar orada əbədi qalacaqlar. Allah onlardan, onlar da Allahdan razıdırlar. Onlar Allahın firqəsidirlər. Bilin ki, Allahın firqəsi – məhz onlar nicat tapıb əbədi səadətə qovuşanlardır».*** *(əl-Mücadələ 22).* ***«Onlar ancaq öz Rəblərinə təvəkkül edərlər*** *(Təvəkkül də qəlbin əməlidir)****».*** *(əl-Ənfal 3).* Bu dəlillər bəyan edir ki, iman qəlbdə olur. İman sayəsində mömininin qəlbi sakitləşir və sabit olur. Bu da onu bildirir ki, insanın ölçülməsi də elə qəlbinə görədir. Əbu Abdullah ən-Numan b. Bəşir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in belə buyurduğunu eşitdim: «…Bunu da bilin ki, insan bədənində elə bir ət parçası var ki, əgər o, sağlam olarsa bütün bədən sağlam olar, yox əgər o, xəstə olarsa onda bütün bədən xəstə olar. Bilin ki, bu qəlbdir»[560]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah sizin bədənlərinizə və görkəminizə baxmaz. Lakin O, sizin qəlblərinizə və əməllərinizə baxar»[561].

İbn Rəcəb - *rahmətullahi aleyhi* - deyir ki: «Qulun əzalarıyla etdiyi hərəkətlərin düzgünlüyü, haramlardan uzaq durması və şübhəli şeylərdən uzaqlaşması, qəlbinin hərəkətinin bir sonudur. Əgər onun qəlbi sağlam və düzgündürsə onda Allahın sevgisindən, onun sevdiklərinin sevgisindən, Allah qorxusundan və Onun xoşlanmadığı şeylərə düşmə qorxusundan başqa bir şey yoxdursa bütün əzaları sağlam və düzgün olur və bunun sonu da hər cür haramlardan uzaq durur və haramlara düşməkdən şübhəli şeylərdən də çəkinir. Əgər qəlbi pozulmuşsa ağlına tabe olma duyğusu və Allahın xoşuna getməsə də belə nəfsi istədiyini etmə arzusu qəlbini zəbt edər, bütün əzalarının hərəkəti pozular. Bu səbəblə də qəlb orqanların hökmüdarıdır, digər orqanlar da onun əsgərləridir deyilmişdir. Onlar qəlbə itaət edən əskərlərdir. Ona itaət və onun əmrlərini yerinə yetirməklə məsuluyyətlidirlər. Heç bir şeydə ona müxalif olmazlar. Əgər hökmüdar yaxşı olarsa əskərlər də yaxşı olarlar. Əgər hökmüdar pis olarsa bu səbəblə də əskərləri də pis olarlar. Allah qatında ancaq səlim bir qəlb fayda verər. Orqanların əməlləri ancaq qəlbin istiqaməti ilə istiqamət taparlar. Qəlbin istiqaməti, onun Allah sevgisi ilə, Allaha itaət sevgisi ilə dolu olması və Allaha qarşı gəlməkdən nifrət etməsi deməkdir. Vücudun hərəkətləri qəlbin hərəkətinə və iradəsinə tabedir. Qəlb sadəcə Allah üçün hərəkət edər və iradəsini istifadə edərsə özü də sağlam olar. Bütün vücudun hərəkətləri də sağlam və düzgün olar. Qəlb Allahdan başqası üçün hərəkət edər və iradəsini başqasına tərəf yönəldərsə qəlbin hərəkəti pozular və bununla da bərabər vücudun hərəkətləri də pozular. Qəlbdə Allahın iradəsi hakim olunca orqanlar ancaq Allahın iradəsinə uyğun olaraq hərəkətə keçər. İbn Teymiyyə - *rahmətullahi aleyhi* - deyir ki: «İmanın əsli qəlbdədir. O, qəlbin sözü və əməlidir. İqrar, təsdiq, sevgi və bağlılıqdır. Qəlbdə nə varsa onun əlamətlərinin əzalar üzərində görünməsi labüddür. Bunlar qəlbdə olanın təsdiqi, dəlili və şahididir. Bunlar mütləq imanın kamilliyinin bir şöbəsi və bir qismidir. Qəlbdə olan orqanlar da olanın əslidir». Qəlbin də sağlam olması üçün düzgün, səhih əqidə və mübarək qəlb əməlləri lazımdır. Qəlb əməlləri də əqidədən doğur. Qəlbdə olan əməlləri Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ümumi olaraq altı işdə cəm etmişdir. Bunlar da qəlb imanının dayaqlarıdır.

---

[560] Buxari 52; Müslim 1599.
[561] Məcmuu Fətava 7/644.

Qəlb imanının dayaqlarından bu altı şey qəlbdə elm tərəfdən cəm olarsa bu artıq sağlam qəlb sayılır və bu qəlb də bu kimi şeylərin əksindən sağlam qalar.

Sələfi Salihin, yəni Əhli Sünnə vəl Cəmaatın iman əsasları Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - in məşhur Cəbrail – *əleyhissəlam* – ın hədisində xəbər verdiyi kimi - altı əsasa iman etmək və onları təsdiq etmək deməkdir. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* -, onların yanına dinlərini onlara öyrətmək və İman haqqında sual vermək üçün gələn Cəbrail – *əleyhissəlam* – a belə cavab vermişdi: «İman, Allaha, Mələklərə, Kitablara, Peyğəmbərlərə, Axirət gününə, Xeyir və Şərrin qədərdən olduğuna iman etməkdir…» . Amr b. Əbəsə – *radıyallahu anhu* – rəvayət edir ki, bir nəfər Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ə dedi: «İslam nədir?». Peyğəmbər: «Qəlbinin Allaha təslim olması və müsəlmanların sənin dilindən və əlindən salamat olmalarıdır» deyə cavab verdi. Adam: «Hansı İslam fəzilətlidir?» deyə soruşdu. Peyğəmbər: «İman etmək» deyə cavab verdi. Adam: «Bəs iman nədir?» deyə soruşdu. Peyğəmbər: «Allaha, Mələklərə, Kitablara, Peyğəmbərlərə və öldükdən sonra dirilməyə inanmaqdır» deyə cavab verdi. Adam: «Hansı iman daha fəzilətlidir?» deyə soruşdu. Peyğəmbər: «Hicrət etmək» deyə cavab verdi. Adam: «Hicrət nədir?» - deyə soruşdu. Peyğəmbər: «Pisliyi tərk etmək!» deyə cavab verdi. Adam: «Hansı hicrət daha fəzilətlidir?» deyə soruşdu. Peyğəmbər: «Cihad» deyə cavab verdi. Adam: «Cihad nədir?» deyə soruşdu.: «Onlarla qarşılaşdığın zaman kafirləri öldürmək» deyə cavab verdi. Adam: «Hansı cihad fəzilətlidir?» deyə soruşdu. «Atının ayaqları kəsilib yerə yıxılaraq öldürüldüyü və qanının axıdıldığı cihad…» . Bu altı xüsus imanın əsaslarıdır. Həmçinin Qurani Kərimdə də Allah bu haqda bir çox ayələr nazil etmişdi. ***«Yaxşı əməl heç də üzünü günçıxana və günbatana tərəf çevirməkdən ibarət deyildir. Yaxşı əməl sahibi əslində Allaha, Axirət gününə, Mələklərə, Kitaba*** *(Allahın nazil etdiyi bütün ilahi kitablara)* ***və Peyğəmbərlərə inanandır».*** *(əl-Bəqərə 177).* ***«Şübhəsiz ki, biz hər bir şeyi müəyyən ölçüdə*** *(qədər)* ***ilə yaratqıq».*** *(əl-Qəmər 49).*

Hər kim bu altı əsasa iman etməzsə onun imanı tamam olmaz. Bunlardan birini inkar edən kimsə kafir olur. O, halda iman bu altı əsas üzərində yüksəlir. Bu əsaslardan birini itirən kimsə, əlbətdə ki, mömin olmaz. Çünkü o, imanın əsaslarından birini itirmiş olur. Necə ki, bir bina ancaq təməl əsasları üzərində yüksələ bilir. Bu əsaslar imanın rükunlarıdır və imanın səhihliyi üçün şərtdir. Əgər insanın imanı olmazsa başqa şeylərdə ibrət və fayda da yoxdur. Kitab və Sünnətə uyğun olaraq bunlara əməl edilmədikcə iman da tamamlanmaz.

***İman Bədən Üzvülərinin Əməlidir*** – deyildikdə Sələflərin qəsdi bədən ilə olan bütün zahiri əməlləri yerinə yetirməkdir ki, bu da iman adlanır və imanı artırır. Əhli Sünnə vəl Cəmaat alimləri deyirlər ki, imanın əsli vardır ki, bu da qəlbdə olur. Qəlbdə olan əsli iman isə insandan zahiri əməlləri tələb edir. Zahiri əməllər də qəlbdəki imanı təsdiqləyir. Hər bir insan nəyisə iddia edirsə onu təsdiqləməlidir. Həkim iddia edirsə ki, mən həkiməm onu təsdiq etməlidir. Əks halda nə qədər: «Mən həkiməm, Mən həkiməm…» olduğunu söyləyirsə söyləsin. Həmçinin mömin də, mömin olduğunu təsdiq etmək üçün zahiri əməlləri olmalıdır. Çünki onun möminliyini sübut edən zahiri əməllərdir. Zahiri iman isə həqiqi imanı bildirir. Kim əzaların əməli olmadan qəlbində əməlin var olduğunu idda edərsə onun üçün iman ismi sabit olmaz. Çünki zahiri sözlər

---

[562] Buxari, Müslim, Əbu Davud, Tirmizi, Nəsəi.
[563] AbdurRazzaq «Musənnəf» 20107, İmam Əhməd 4/114, Təbərani "Kəbir", "Məcmua Zəvaid" 1/59, 3/207, "Təzkiratul Huffaz" 1/94, "Siyer" 4/468, 475.

və fellər imanın ayrılmaz hissəsidir. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurur: «Qulun qəlbi düzgün olmadıqca imanı düzgün olmaz. Dili düzgün olmadıqca qəlbi düzgün olmaz. Qonşusu onun pisliyindən əmin olmayan bir kimsə Cənnətə girməz» . İbn Teymiyyə - *rahmətullahi aleyhi* - deyir ki: «Vücud sağlıqlı olmadığı zaman bu durum qəlbin də sağlam olmadığına dəlalət edir. İman kəlimələrini söyləyən lakin əməl etməyən kimsənin qəlbinin mömin olmadığı bilinir. Çünki vücud qəlbə tabedir. Qəlbdə hər hansı bir şey yerləşdiyi zaman nə olursa olsun onun əlamətləri bədəndə də ortaya çıxacaqdır» . Bədən ilə olan əməllərə: Məs: Namaz, oruc, zəkat, həcc, cihad və s. aid etmək olar. Əhli Sünnədən heç kəs ixtilaf etməyib ki, imanın əsası qəlbdədir. Hətta Əhli Sünnəyə müxalif olanlar da imanın dil və qəlb ilə olmasıda müxalif olmayıblar. Yalnız Kərramilər firqəsindən başqa. Lakin əməlin imandan olasına gəlincə isə müxalif olublar.

## ƏMƏLLƏR İMANDANDIR

«Əməllər iman deyilən şeyin içərsinə girməz» - deyənlər, iman tək bir şey olduğuna görə: «Mənim imanım Əbu Bəkr əs-Sıddıq, Ömər – *radıyallahu anhum* – nun imanı kimidir. Hətta mənim imanım Peyğəmbərlərin, Rəsulların, Cəbrailin və Mikailin imanı kimidir» - deyənlər də vardır.

***Sələflər*** və ***Murciyə*** arasında mübahisə əməllərin imandan olub-olmamasıdır. Əməllər imanın əsası üçün deyildir. Çünki imanın əsası qəlbdədir. Lakin əməlsiz də iman yoxdur. Əgər qəlbdə iman olarsa zahirdə də olmalıdır. Hər bir müsəlmanda imanın başlanğıcı olur. Sonra get-gedə də artır. Çünki imanın əsli və kamilliyi vardır. İmanın əsli qəlbdədir. Bu da başlanğıcdır. Bu başlanğıc da kifayət deyildir. Bu başlanğıc (imanın əsli) insanın dünya və axirətdə əmin olması üçün kifayyət deyildir. Belə bir insan bununla kifayətlənərsə o, əmin ola bilməz. Əgər o, imanı kamilləşdirməsə dünya və axirətdə təhlükələrə, cəzaya məruz qalar. Buna görə də ona vacibdir ki, imanın vacib şöbələrini tamamlasın ki, nicat tapanlardan olsun.

***Sələflər*** – əməl imandandır. Bununla onlar nə qəsd edirlər? Hər hansı bir əməl imandandır, yoxsa yaxşı əməllər. Onlar qəsd edirlər ki, bütün itaətlər imandandır. İtaət də Allahın əmrinə müvafiq olaraq yerinə yetrilməlidir. Əgər əməl Allahın əmrinə müvafiq olmazsa itaət sayılmaz. Məs: Oruc tutmaq ibadətdir. Lakin sən bayram günü oruc tutsan bu əməl Allah və Rəsulunun əmrinə müvafiq olmadığı üçün itaət sayılmaz. Əməllər imandandır dedikdə onlar yalnız saleh əməlləri qəsd edirdilər.

Ayə və hədislərdən bizə məlum olduğuna görə - əməl olmadıqca iman kamil olmaz. Niyyətsiz nə söz və nə də əməl olur. Sünnətə uyğun olmadıqca da nə söz, nə əməl, nə də niyyət olur. Möminlərin əmiri Əbu Hafsa Ömər b. əl-Xattab – *radıyallahu anhu* – rəvayət edir ki, mən Rəsulullah – *sallallahu aleyhi və səlləm* - in belə buyurduğunu eşitdim. «Əməllər ancaq niyyətlər ilədir və hər bir şəxs üçün niyyət etdiyi bir şey vardır. Hər kimin hicrəti Allah və Rəsulu ücündürsə, onun hicrəti Allah və Rəsulu

---

[564] Əhməd «Musnəd» 3/198, əl-Alabni «Səhih Silsilə» 2841.

[565] Məcmuu Fətava 14/121.

[566] Məzhəbin banisi Əbu Abdullah b. Kərram əs-Sicistanidir. Onlar həm Müşəbbihə (Allahı yaradılmışlara bənzədənlər), həm Mücəssimə (Allahı cism sayanlar), həm də Murciyədilər. On iki firqədilər. İman sadəcə dil ilə söyləməkdir deyirlər.

[567] ***Hicrət*** – tərk etmək deməkdir. Küfür ölkəsindən İslam yurduna köçmək. Həmçinin Allahın qadağalarını tərk etmək də hicrət adlanır.

üçündür. Hər kimin hicrəti əldə edəcəyi bir dünyalıq və ya nigahlanacağı bir qadın üçündürsə, onun hicrəti nə üçün hicrət etmiş isə elə onadır» . Həsənul Bəsri - *rahmətullahi aleyhi* - deyir ki: «Əməl olmadıqca söz səhih olmadığı kimi, niyyət olmadıqca da, əməl və söz də səhih deyildir. Bir kimsə sünnət üzərə olmadıqca da, nə söz, nə əməl, nə də niyyət səhih olur» . Səhl b. Abdullah Tusteri - *rahmətullahi aleyhi* – dən: «Ya imam! İman nədir?». O: «İman, söz, əməl, niyyət və sünnətdir. İman olur, lakin əməl olmazsa iman deyil küfr olur. Əgər iman olur niyyət olmazsa bu da nifaq olur. Əgər iman olur, əməl olur, niyyət olur, lakin sünnətə uyğun olmazsa bu da bidət olur» . Əhməd b. Əbi Havari - *rahmətullahi aleyhi* - deyir ki: «Kim Rəsulullahın sünnətinə uymadan bir əməl edərsə onun bu əməli batildir» . İbn Qeyyim - *rahmətullahi aleyhi* – deyir ki: «Niyyət əməllərin ruhudur. Niyyətə möhtac olan əməllərsə cəsəd durumundadır. Əgər niyyət olmazsa bədənlə edilən əməllər ölüdür. O, halda qəlbdə olan əməllərin mərifəti bədənə aid olan əməllərin mərifətindən daha önəmli və öndədir» . Sələflər deyirlər ki: «Mənə elə bir əməl deyin ki, onunla daima Allaha əməl edim. Ona: «Xeyir niyyət et! Sən bununla əməl etmiş olarsan əməl etməsən də belə. Sən niyyətində xalis olsan əməlin azı da sənə kifayət edər». Allah Qurani Kərimdə də bir çox ayələrdə iman ilə saleh əməli birlikdə qeyd edir. ***«İman gətirib saleh əməl edənlərin mənzili isə Firdovs Cənnətləri olacaqdır!»*** *(əl-Kəhf 107).* ***Şübhəsiz ki: «Rəbbim Allahdır deyən, sonra da*** *(söz və əməllərində)* ***düz olan kəslərə*** *(ölüm ayağında)* ***mələklər nazil olub belə deyəcəklər: Qorxmayın və kədərlənməyin! Sizə vəd olunan Cənnətlə sevinin».*** *(Fussilət 30).* ***«Bu sizin*** *(dünyada)* ***etdiyiniz yaxşı əməllər müqabilində varis olduğunuz Cənnətdir».*** *(əz-Zuxruf 72).* ***«Yalnız iman gətirib saleh əməllər edən, bir-birinə haqqı tövsiyə edən və səbri tövsiyə edən kimsələrdən başqa».*** *(əl-Əsr 3).*

Sələflərin verdiyi tərif bu hədisdə öz əksini necə də gözəl tapmışdır. Üç əmələ bir hədisdə dəlil vardır. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «İman yetmiş, yaxud da altmışdan çox şöbələrdən ibarətdir. Ən fəzilətlisi, Allahdan başqa ilah olmadığını (***Lə Iləhə Illəllah***) söyləmək, ən aşağı şöbəsi isə yolda olan maneəni dəf etməkdir. Həya da imanın bir şöbəsidir» . Dinə girmək üçün ilk söylənilən şəhadət kəlməsidir ki, etiqad etibarı ilə qəlbin əməli, söyləmək etibarı ilə dilin əməlidir, əziyət verən şeyi yoldan qaldırmaq – əzaların əməli, həya da – qəlbin əməlidir. Yolda əziyyət verən şeyləri dəf etmək bir əməl olduğu halda, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - onu imandan saymışdı. Həmçinin də: Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Bir və tək olaraq Allaha iman etməyinizi əmr edirəm. Bir və tək olaraq Allaha iman etməyin nə olduğunu bilirsinizmi?» Onlar: «Allah və Rəsulu daha gözəl bilir!». O, buyurdu: «Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına, Muhəmmədin onun Rəsulu olduğuna şəhadət etmək, namaz qılmaq, zəkat vermək və qənimətin 1/5-ni verməkdir» . Bu hədisdə Rəsulullah – *sallallahu aleyhi və səlləm* - zahiri əməlləri imana misal çəkir.

---

568 Buxari, Müslim.
569 Lələkai «Şərhu Usulu Etiqad Əhli Sünnəti vəl Cəmaat» 1/57.
570 İbn Teymiyyə «İman» s. 143.
571 «Risalətul Kuşeyriyə» s. 22.
572 "Bədailul Fəvaid" 3/330.
573 Buxari, Müslim.
574 Buxari, Müslim, Nəsai, Əbu Davud.

İbn Batta – *rahmətullahi aleyhi* - deyir ki: «Buxari – *rahmətullahi aleyhi* - nin iman bölümündə qeyd etmək istədiyi məna da elə budur. O, bölümün bütün bablarını bu əsasa görə açmışdır. Məs: Umurul iman (imandan olan işlər) Namaz imandandır, zəkat imandandır, cihad imandandır adı altında açdığı başlıqlar ilə o, Murciənin - *iman əməlsiz sözlərdən ibarətdir* - (yəni əməl imandan ayrıdır) sözlərini rədd etmiş, onların bu səhf fikirlərini Quran və Sünnə ilə bəyan etmişdir . ***Allah sizin imanınızı** (bundan əvvəl Beytulmüqəddəsə üz tutaraq qıldığınız namazlarnızı) **əvəzsis buraxmaz.** (əl-Bəqərə 143)*. Qiblə dəyişilməmişdən əvvəl müsəlmanlar ölmüş və ya öldürülmüşdülər. Biz onlar barəsində nə deyəcəyimizi bilmirdik. Bəra b. Azim – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – ilə birlikdə **16-17** ay Beytul-Məqdisə tərəf namaz qıldıq. Allah: ***«(Ya Muhəmməd!)** **biz sənin üzünün göyə tərəf çevrildiyini görürük, ona görə də sənin razı olduğun qibləyə tərəf döndərəcəyik. İndi üzünü MəscidulHarama tərəf çevir.** (Ey müsəlmanlar!) **Harda olsanız** (namaz vaxtı) **üzünüzü oraya döndərin! Kitab verilmiş ümmətlər bunun öz Rəbbi tərəfindən bir həqiqət olduğunu yaxşı bilirlər. Allah onların əməllərindən xəbərsiz deyildir».** (əl-Bəqərə 144)»* . İbn Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, insanlar Quba məscidində sübh namazını qıldıqları vaxt biri gələrək: «Bu gecə Rəsulullah – *sallallahu aleyhi və səlləm* – ə Quran ayəsi endirilmiş və Kəbəyə tərəf dönməyimiz əmr edilmişdir. Siz də Kəbəyə tərəf dönün. Quba məscidinin camaatı da Şama tərəf olduqları halda Kəbəyə yönəldilər» . Allah bu ayəni nazil etdi. Allah bu ayədə namazı iman deyərək adlandırmışdı. Səhabələr öz qardaşlarının Beytul Məqdisə tərəf üz tutaraq qıldıqları namazlarına görə qorxuya düşmüşdülər. Çünki İslamın ilk əvvəllərində müsəlmanlar Beytul Məqdisə tərəf namaz qılardılar. Onlar namaz Məscidul Harama (Kəbəyə) vacib olmamışdan qabaq ölmüşdülər. Səhabələr bilirdilər ki, Qibləyə yönəlmək namazın şərtlərindəndir. Bu şərt olmadan da namaz qəbul deyildir. Onlar da heç qibləyə tərəf yönəlməmişdilər. Onlar elə zənn edirdilər ki, qiblənin nəsx olunması ilə onların əməlləri də nəsx olunmuşdur. Lakin Allah onların qəlblərini arxayın edərək ayə nazil etdi: ***«Allah sizin imanınızı əvəzsis buraxmaz».*** Allah onların bu şübhələrini aradan qaldırdığı zaman onlara demədi ki: «Sizin namazınızı zay etməz (əvəzsiz buraxmaz)», əksinə onlara buyurdu ki: «Sizin imanınızı zay etməz (əvəzsiz buraxmaz). Bununla onların diqqətini ən mühüm bir işə yönəltdi. Çünki bu namaz Beytul Məqdisə tərəf üz tutularaq qılınmışdır. Onlar da Allahın əmrinə müvafiq olaraq namaz qılmışdılar. Onların bu əməlləri itaətdir, itaətdə imandır, imanda Allahın dərgahında necə zay ola bilər. Burada imandan da qəsd olunan namazdır. Namaz həm qəlbin, həm dilin, həm də əzaların əməllərini bir yerdə birləşdirir.

Qısaca iman – qəlbdə yer tutan əməl tərəfindən təsdiqlənən, meyvələri Allahın əmrlərini yerinə yetirmək, qadağan etdiklərindən çəkinmək ilə ortaya çıxan şeydir. Əgər elm əməldən uzaq olarsa, onun heç bir faydası da olmaz. Əməldən uzaq bir

---

[575] İbn Batta – *rahmətullahi aleyhi* - Adı Əli b. Haləf b. AbdulMəlikdir. əl-Ləccam deyə tanınır. Hədis elimində tanınmışdır. Məliki məzhəbindəndir. İbn Həcər – *rahmətullahi aleyhi* - «Fəthul Bəridə» ondan çox danışır.

[576] Nəvəvi, Müslümin şərhi 1/125.

[577] Müslim 525 Əbu Zərr – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – dən yer üzündə ilk inşa edilən məscid haqqında soruşdum. O: «MəscidulHaramdır» deyə buyurdu. Mən: «Sonra hansıdır?» deyə soruşdum. O: «MəscidulAqsa» deyə buyurdu. Mən: «Bu iki məscidin qurluşu arasında nə qədər vaxt vardır?» deyə soruşdum. O: «Qırx il» deyə buyurdu – Müslim 520.

[578] Müslim 526.

elimin bir kimsəyə faydası olsaydı, Allahın lənətinə düçar olan iblisə faydası olardı. O, Allahın şəriki olmadığına, tək olduğuna, sonunda da ona qaytarılacağını bilirdi. Lakin Allah: «Adəmə səcdə et!» deyə əmr verdikdə o, təkəbbürlüyündən səcdə etməyib kafirlərdən oldu. *(Allah)* ***buyurdu: «Ey iblis! Sənə mənim öz əlimlə yaratdığıma səcdə etməyə nə mane oldu? Təkəbbür göstərdin, yoxsa özünü yuxarı tutdun? Qiyamət gününə qədər mənim lənətim sənin üstündən əskik olmasın!».*** *(Sad 75-78).* Allahın vəhdəniyyətini bilməsi ona (İblisə) fayda vermədi. Çünkü əməldən ayrı bir elmin aləmlərin Rəbbinin tərəzisində heç bir ağırlığı yoxdur. Şeyx Useymin– *rahmətullahi aleyhi* – «Üç Əsas» kitabının şərhində dediyi kimi: «Əməl elmin meyvəsidir. Kim elmsiz əməl edərsə o, Xristianların misalındadır. Elmi olmaqla bərabər əməl etməyən kimsə isə Yəhudilərin misalındadır».

İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Bizim sələfimizdən keçib gedənlər iman ilə əməlin arasını ayırmazdılar. Əməl imandan, iman da əməldəndir. Əməl imanı doğruldur. Hər kim dili ilə inanır, qəlbi ilə tanır və əməli ilə təsdiq edərsə o, qopmayan bir qulpdan yapışmış olur. Hər kim də dili ilə söyləyər, qəlbi ilə tanımaz və əməli ilə təsdiq etməzsə o, axirətdə uduzanlardandır. Əvvəlkilərlə sonraki insanlardan çoxsunun da söylədiyi: «Onlar əməli sözün təsdiqləyicisi olaraq görərdilər» . İman əl-Əvzai, Məlik b. Ənəs və Səid b. AbdulƏziz – *rahmətullahi aleyhi* – onlar: «İman əməlsiz sözdür» deyənləri xoş qarşılamazdılar. Əməlsiz iman, imansız da əməl olmaz deyərdilər . Əbu Ubeyd b. Qasım ibn Səlləm – *rahmətullahi aleyhi* – deyir ki: «Bil ki, elm adamları və din ilə maraqlananlar bu mövzuda iki qrupa ayrıldılar. Bir qrup dedi ki, iman, Allaha qarşı ixlaslı olmaqla dillərin şahidlik etməsiylə və əməllə gerçəkləşir. Bir qrup da dedi ki, xeyir! İman qəlblərlə və dillərlə gerçəkləşir. Əməllərə gəlincə isə bunlar təqva və yaxşılıqdır. İmandan deyildir. İki qrupun ixtilafını incələdiyimiz zaman Kitab və Sünnətin iman, niyət, söz və əməlin hamısı ilə həqiqət olduğunu və digər qrupun dediklərini rədd etdiyini gördük» . İmam əl-Əvzai – *rahmətullahi aleyhi* – deyir ki: «İman yalnız söz ilə istiqamət tapır (doğru və düzgün olur). İman və söz yalnız əməllə istiqamət tapır. İman, söz və əməl yalnız sünnətə uyğun bir niyyətlə istiqamət tapır. Sələfdən ölüb gedənlər əməli imandan, imanı da əməldən ayırmazdılar. Hər kim dili ilə iman edər, qəlbi ilə təsdiq, əməli ilə də bunu doğrulayarsa həqiqətən bu qopmayan sağlam bir ipdir. Hər kim də dili ilə söyləyər, qəlbi ilə təsdiq etməzsə, əməli ilə də doğrulamazsa onun imanı qəbul edilməz və axirətini də itirmiş olar» . Abdullah b. əl-Humeydi – *rahmətullahi aleyhi* – deyir ki: «İman söz və əməldir, artar və əskilər. Əməlsiz imanın faydası yoxdur. Niyyətsiz əməl və sözün faydası yoxdur. Sünnətsiz söz, əməl və niyyətin də faydası yoxdur» . Beləliklə bizə aydın oldu ki, əməl imanın ayrılmaz bir hissəsidir.

## İMANIN ARTIB AZALMASI

Sələflərə görə iman hissələrdən ibarətdir. Tək (kütlə halında olan bir) şey deyildir. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in buyurduğu kimi: «İman yetmişdən çox şöbələrdən ibarətdir». Bu imanın şöbələrindən bəziləri yox olmaqla iman büst bütün

---

[579] İman s. 280.
[580] Lələkai «Şərhu Üsulu Etiqadi Əhli-Sünnə Vəl Cəmaat» 4/930 (1586).
[581] Əbu Ubeyd qasım İbn Səlləm s. 9, Təhqiq əl-Albani.
[582] Lələkai «Şərhu Üsulu Etiqadi Əhli-Sünnə Vəl Cəmaat» 5/955 (1591).
[583] əl-Humeydi «Usuli Sünnə və ya Musnəd» 2/546.

yox olmaz. Bir qismi yox olduqda digər qismi qalır. Həmçinin digər ibadətlərdən olan namaz da belədir. Namazda elə ünsurlar vardır ki, bu ünsurların yox olması namazın sünnətlər tərəfdən əskikliyini zədələr, elə ünsurlar da vardır ki, onlar vaciblər tərəfdən namazı zədələyər. Lakin namazın büst bütün yox olmasına gətirib çıxarmaz. Həmçinin həcc ibadətində də elə ünsurlar vardır ki, onların əskik olması həcc ibadətində müəyyən əskikliklər yaradar. Lakin ibadəti batil hala gətirməz. Bu məsələdə də Əhli Sünnəyə müxalif olanlar tapılmışdır. Kim ki, Əhli Sünnəyə imanın məfhumunda müxalif olubsa bu mövzuda da müxalif olublar. Murciyə məzhəbi deyir ki, əməllər imana daxil deyildir. Onlara görə iman bir şeydir nə artır, nə də azalır. Xəvariclər, Mötəzilə məzhəbi deyirlər ki, əməllər imana daxildir. Kütlə şəkilindədir nə artır, nə də azalır.

O, kəslər ki, deyirlər bu ayələr imanın artıb, azalmasına dəlil deyildir. Bunları necə təvil ediblər. Allah buyurur ki: ***«Onların imanı artar».*** Onlar deyirlər ki, burada artmaq dedikdə inanılası şeylər artır. Bir ayə nazil olmuşdur. İndi isə bir neçə surə, ayə nazil olmuşdur. Qəlbdə iman artmır. Artan təkliflərin, qanunların artması deməkdir. Onlara görə bütün möminlər bərabərdilər. Əlhəmdulilləh ki, Allahın nazil etdiyi ayələr möhkəm və açıq-aydındır. Onlara rədd üçün kifayətdir. Bu boş sözləri batil edir.

Əhli Sünnə vəl Cəmaatın əqidəsinə görə iman həm artar, həm də azalar. Bu haqda Quran və Sünnədə bir çox ayə və hədislər vardır. ***«Bir surə nazil edildiyi zaman münafiqlərdən: «Bu sizin hansınızın imanını artırdı? deyənlər də var. Möminlərə gəlincə*** *(hər bir surə)* ***onların imanını artırar və onlar*** *(bu surələrin nazil olmasına)* ***sevinərlər».*** *(ət-Tövbə 124).* Ayələr oxunduğu zaman onların imanı artar və azalar. ***«Allaha və Peyğəmbərə itaət edənlər*** *(axirətdə)* ***Allahın nemətlər verdiyi Nəbilər*** *(Peyğəmbərlər)* ***siddiqlər*** *(tamamilə doğru danışanlar, etiqadı dürüst, Peyğəmbəri hamıdan əvvəl təsdiq edən şəxslər)**, şəhidlər və salehlərlə*** *(yaxşı əməl sahibləriylə)* ***bir yerdə olacaqlar. Onlar isə necə də gözəl yoldaşlardır».*** *(ən-Nisa 69).* Bu ayə onların imanına görə tərtib edilmişdir. ***«Biz də onların hidayətini artırmışıq».****(əl-Kəhf 13).»****Allah doğru yolda olanların doğruluğunu artırar».*** *(Məryəm 76).* ***«Doğru yolu tapanlara gəldikdə isə Allah onların doğruluğunu daha da artırar».*** *(Muhəmməd 17).* ***«Möminlərin imanı üstünə iman artırmaq üçün onların qəlblərinə səkinət nazil edən odur…».*** *(əl-Fəth 4).* Bu ayə onların təvillərini boşa çıxardır. Çünki nazil olan səkinət, rahatçılıq – qanunlar, təkliflər deyildir. Səkinət, rahatçılıq Allahın bir felidir ki, bunu möminlərin qəlbinə qoyur. Onlar da bununla rahatlıq tapırlar. ***«İman gətirənlərin imanının daha da artması».*** *(əl-Muddəssir 31).* ***«Bu yalnız onların imanını və itaətini artırdı».*** *(əl-Əhzab 22).* ***«O, kəslər ki, xalq onlara: Cəmaat sizə qarşı*** *(qüvvə)* ***toplamışdır onlardan qorxun! dedikdə*** *(bu söz)* ***onların imanını daha da artırdı və onlar Allah bizə bəs edər. O nə gözəl vəkildir! deyə cavab verdilər».*** *(Ali-İmran 173).* ***«Möminlər yalnız o kəslərdir ki, Allahın adı çəkildikdə*** *(onun heybət və əzəmətindən)* ***ürəkləri qorxudan titrəyər, Allahın ayələri oxunduğu zaman həmin ayələr onların imanlarını daha da artırar, onlar ancaq öz Rəblərinə təvəkkül edərlər. Namaz qilar və verdiyimiz ruzidən sərf edərlər».*** *(əl-Ənfal 2-3).* Hənzələ b. ər-Rəbi b. Sayfi əl-Useyyidi ət-Təmimi – *radıyallahu anhu* –, Əbu Bəkr – *radıyallahu anhu* – ilə birlikdə Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in hüzuruna girərək dedi: «Hənzələ münafiqlik etdi, ya Rəsulallah!». Rəsulallah: «Nə oldu belə?» Hənzələ: «Ey Allahın Rəsulu! Sənin yanında olduğumuz zaman bizlərə (Cəhənnəm) atəşini və Cənnəti xatırladırsan. Elə bil ki, bunları gözlərimizlə görmüş kimi oluruq. Ancaq sənin yanından ayrıldığımız zaman ailə, uşaqlar və dünya keçimi ilə o, qədər məşğul oluruq

ki, (bizə xatırlatdığın bu şeyləri) unuduruq». Rəsulullah: «Nəfsim əlində olan Allaha and olsun ki, əgər sizlər mənim yanımdaykən və zikirdəykən olduğunuz hal üzrə olmağa (hər yerdə) davam etsəniz şübhəsiz mələklər sizinlə döşəklərnizdə və yollarnızda toqquşardılar». Başqa rəvayətdə: «Yollarda sizə salam verərdilər». Bir başqa rəvayətdə isə: «Sizləri evlərnizdə ziyarət edərdilər» . Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Sizdən kimsə bir münkər gördükdə onu əli ilə düzəltsin. Əgər gücü çatmazsa dili ilə, bunu da bacarmadıqda qəlbi ilə (düzəltsin). Bu isə imanın ən zəif mərtəbəsidir» . Abdullah b. Məsud – *radıyallahu anhu* – nun rəvayətində isə: Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Bundan aşağı (imandan) bir xardal dənəsi də belə yoxdur . Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Möminlər arasında imanı ən kamil olanı əxlaqı ən gözəl olanıdır» . Əbu Hureyrə -*radıyallahu anhu*– rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qonşusu şərrindən əmin olmayan insan Cənnətə girməz (Başqa rəvayətdə: İman etmiş olmaz, iman etmiş olmaz, iman etmiş olmaz o, kimsə ki, qonşusu onun şərrindən əmin deyildir)» . Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir-birinizi sevmədikcə iman etmiş olmazsınız» . Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurur: «Çox gülmək qəlbin imanını məhv edir». İbn Ömər – *radıyallahu anhu* – dan soruşulduqda ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - in səhabələri gülərdilər: «Bəli! Əgər iman qəlblərində dağdan da böyük olsaydı» . Həmçinin Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Qiyamət günü Allah buyuracaq: «Ya Muhəmməd! Başını qaldır, söylə! Sözün dinlənilir! İstə sənə verilir! Şəfaət et! Şəfaətin qəbul edilir!». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurur: «Ya Rəbbim! Ümmətim, ümmətim!» Allah buyuracaq: «Get! Qəlbində buğda və ya arpa dənəsi qədər iman olan kimsə varsa Cəhənnəmdən çıxart!…» Onları çıxartdıqdan sonra Allah buyuracaq: «Get! Qəlbində xardal dənəsi qədər iman olan kimsələri oradan çıxart!…» Onları da çıxartdıqdan sonra Allah buyuracaq: «Get! Qəlbində xardal dənəsindən daha az, daha az, daha az iman olan kimsələri oradan çıxart!…». Başqa rəvayətdə isə Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurur: «Qəlbində dinar, yarım dinar ağırlığında iman olan kimsələri oradan çıxart, əlavələri də vardır». Onalrın iman dərəcələrinə görə atəş onlardan kimisinin ayaqlarının yarsına qədər, kimisinin diz qapaqlarına qədər yandırar . Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Zinakar, zina etdiyi vaxt mömin olduğu halda zina etməz, içki içən, içki içdiyi vaxt mömin olarsa içki içməz, oğru, oğruluq etdiyi vaxt mömin olarsa oğurluq etməz» . Belə bir şəxsin imanı əskik bir mömindir və ya imanı ilə mömin, etdiyi günahı səbəbi ilə fasiqdir. Bu vəziyyətdə ona nə mütləq olaraq iman adı verilir, nə də mütləq olaraq ondan iman adı alınır. Yəni Əhli Sünnəyə görə belə bir kimsənin iman adı qaldırılmaz.

---

[584] Müslim, Tirmizi 2514, İbn Məcə 4239, Əhməd 2/304,305, əl-Albani «Səhih Hədislər Silsiləsi» 1948, «Səhihul Cəmius Səğir» 7073, «Mişkətul Məsabih» 2268.
[585] Müslim.
[586] Müslim.
[587] Əbu Davud 2682, Tirmizi 1163, Musnəd 2/250,472,527.
[588] Müslim 46.
[589] Müslim.
[590] əl-Albani «Mişkətul Məsabih» 4749.
[591] Şəfaət hədisi haqqında geniş məlumata görə Səhih Buxari və Müslimə baxa bilərsiniz.
[592] Müslim.

Mötəzilə və Xavariclərin dedikləri kimi onun əbədi olaraq Cəhənnəmlik olduğunu deməzlər. Günah işləyən kimsənin imandan çıxmadığını da ittifaq ilə qəbul etmişlər. Əksinə belə bir kimsə Allahın mərhəmətinə qalmışdır, dilərsə onu bağışlayar, dilərsə əzab edər. İmam Əhməd – *rahmətullahi aleyhi* – dən murciyəlilərə aid sual soruşulduqda belə cavab vermişdir: «Bizlər deyirik ki, iman söz və əməldir. Artar və əskilər. Bir kimsə zina edər, içki içərsə imanı əskilər» .

Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Kim Allah üçün sevər, Allah üçün nifrət edər, Allah üçün verir və Allah üçün qadağan edərsə imanı tamamlanmış olar» . Sevgi və nifrət qəlbdə olan şeylərdir. Vermək və mane olmaq isə zahirdə olan şeylərdir ki, bunlar üçün də ixlas şərtdir. O, ixlas ki, imanın ruhu, sirri və əsasıdır. Bu hədis Uca bir qaydaya dəlalət edir ki, bəndələrdən kamillik dərəcəsinə çatanlar güclü ixlası ilə seçilirlər. ***İxlas*** **–** Allaha itaətdə, ibadətdə həqiqi ehsan Allahı görür kimi ibadət etməkdir. İxlas, sahibini ən uca dərəcəsinə çatdırır. Hər bir ibadətdə ixlas çox əsaslı və qüvvətli bir şəkildə olduğu zaman o, əməl xalis Allah üçün edilən əməldir. O, əmələ Allahın verəcəyi əcr və mükafat da çox böyük olacaqdır. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «İnsan əməllərdən hər hansı bir növünü tam bir ixlas, tam bir qulluq səmimiyyəti əsasında yerinə yetirərsə Allah o, əməl səbəbilə qulunun bir çox böyük günahlarını məğfirət edər. Edilən əməl qəlbdəki iman və ixlasın dərəcəsinə görə fəzilət qazanır. Ona görə də səmərə və xeyirli nəticə verir» . Fudeyl b. İyad – *rahmətullahi aleyhi* – deyir ki: «Bir işi insanlar üzündən tərk etmək riyadır, əməli insanlar üçün etmək şirkdir. İxlas ilə Allah səni bunların hər ikisindən də xilas etməsidir». Cuneydi Bağdadi – *rahmətullahi aleyhi* – deyir ki: «İxlas Allah ilə qul arasında bir sirdir. Onu mələk bilməz ki, yazsın, şeytan bilməz ki, pozsun». İxlas kiçik bir əməli dağ boyda edə bilər. Riya isə böyük bir əməli o, qədər kiçildər ki, Allahın dərgahında heç bir ağırlığı olmaz. İxlas mübah bir əməli ibadətə çevirir. Buna görə də əməldə ixlas olmasa insana yalnız yorğunluq qalar. İnsan Sünnəyə də tabe olarsa artıq bu insanı Allaha daha da yaxınlaşdırar. Əgər bu da ixlasla olarsa.

***Allahı Sevmək*** – Allahın sevdiyi əmrləri, vaxtları, zamanları, halları sevməkdir. Allahın sevdiyi Peyğəmbərləri və Peyğəmbərləin tabeçilərini sevməkdir.

***Allah Üçün Nifrət Etmək*** – Allahın nifrət etdiyi və sevmədiyi hər bir şeyə nifrət etmək. Küfrə, fasiqliyə, asiliyə bununla sifətlənən şəxslərə və bu işə çağıranlara da nifrət etməkdir.

***Allah Üçün Vermək*** – Bu da bəndənin üzərinə düşən hər bir şeyi (verməyi) əhatə edir. ***«Kim*** *(malını Allah yolunda)* ***versə,*** *(Allahdan)* ***qorxsa, və ən gözəl sözü*** *(Lə İləhə İlləllah kəliməsini)* ***təsdiq etsə, biz ona Cənnəti müyəssər edəcəyik! Amma kim*** *(malını Allah yolunda xərcləməyə)* ***xəsislik etsə,*** *(mal-dövlətinə güvənib Allaha)* ***möhtac olmadığını sansa, və ən gözəl sözü*** *(Lə İləhə İlləllah kəliməsini)* ***yalan saysa, Biz onu Cəhənnəm üçün hazırlayacağıq!».*** *(əl-Leyl 5-10).* İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki, əgər bir şəxsdə bu şeylər cəmləşərsə qoy onda o, şəxs sevinsin. Allah üçün vermək, Allahdan qorxaraq pis əməllərdən çəkinmək və ən gözəl sözü təsdiq etmək.

---

[593] İmam Əhməd «Sünnə» 1/307.
[594] İmam Əhməd 3/438,440, Əbu Davud 4681, Tirmizi 2521, əl-Albani «Səhih Hədislər Silsiləsi» 380, «Səhih Cəmius Səğir» 5965, «Mişkətul Məsabih» 30,31.
[595] Minhəc Sünnə Nəbəviyyə 6/218-221.

***Allah Üçün Qadağan Etmək (Verməmək)*** – Bu dörd şeylə bəndənin imanı və dini tamamlanır. Bu hədislərin hər biri onu bəyan edir ki, iman kamilləşir nə vaxt ki, insan bu kimi şeyləri özündə taparsa. Yox əgər insan bu kimi xislətləri özündə tapmazsa onun imanı naqisləşir. Bu kimi əlamətlər onun imanının güclü olduğuna dəlildir və bu da imanın şöbələridir. Bunların hər biri olmalıdır ki, iman kamil olasun. Bunlar olmasa insanın imanı kamilləşməz. Əgər insanın imanı kamilləşərsə o, kimsə bu kimi xislətləri özündə tapmalıdır.

İbn Abbas – *radıyallahu anhu* - rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Rəbb olaraq Allahdan, din olaraq İslamdan və Rəsul olaraq Muhəmməddən razı olan kimsə imanın şirinliyini, tamını tapar»[596].

***Rəbb Olaraq Allahdan*** – razı qalmaq insanda Allahın verdiyi hökmlərlə, Qəza və Qədəri ilə razı qalmağı, sevinməni tələb edir. Bu uca nemətə görə Allah – *subhənəhu və təalə* – yə həmd etmək lazımdır ki, bu da ən böyük nemətdir. İmanı artırmaq üçün ən böyük amillərdən biridir. Ərəb dilində ***Razi*** sözü - bəzən qəbul etmək, bəzən də kifayətlənmək mənasını verir. Əgər insan razı qalarsa, kifayətlənərsə artıq Allahdan qeyrisinə ehtiyacı olmaz. Qeyrisinə yönəlməz və qeyrisindən heç bir şey istəməz. Allahın Rəbb olmasından razı qalarsa o, insanın qəlbi müəyyən bir mənfəəti əldə etmək üçün və hər hansı bir zərəri aradan qaldırmaq üçün Allahdan qeyrisinə onun qəlbi yönəlməz. Çünki o, insanın qəlbi Rəbbinə bağlanarsa imanı kamilləşər. İmam Şafii – *rahmətullahi aleyhi* – deyir ki: «İnsanları razı salmaq ağla sığmayan bir şeydir. O, halda sənin halını düzəldən işə bax. Ondan ayrılma və ondan başqa hər bir şeyi də kənara burax. Yardılmışları razı salmaq nə sənin gücün dairəsində olan bir şeydir, nə də əmr olunan bir şeydir. Yaradanı razı salmaq isə güc yetrilə bilən və əmr olunan bir xüsusiyyətdir». Aişə – *radıyallahu anhə* – nin Muaviyə – *radıyallahu anhu* – ya nəsihət olaraq yazdığı məktubda ona Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in sözlərini ona çatdıraraq deyir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim insanları qəzəbləndirərək Allahı razı salarsa, Allah da ondan razı olar və insanları da ondan razı edər (Başqa rəvayətdə: Onu insanlara möhtac etməz). Kim də Allahı qəzəbləndirərək insanları razı salmağa çalışarsa Allah da ona qəzəblənər və insanları da onun üstünə qəzəbli olaraq salar (Başqa rəvayətdə: Onun işini insanlara həvalə edər)»[597]. Onun istədiyi, tamah etdiyi dünya və axirət Allahın əlindədir. Çünki o, kimsə Allahdan razı qalıb. Allahın sevdiyi və razı qaldığı şeylərə itaətlə yönəlir. Çünkü o, bilmişdir ki, hər bir xeyir, onun öz xeyiri də Allahın əlindədir. Allahın Rəbb olması ilə razı qalan insan məxluqdan ümüdünü üzmüşdür. Əbul-Abbas Abdullah b. Abbas - *radıyallahu anhu*– rəvayət edir ki, bir gün (minikdə) Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in arxasında oturmuşdum. O, buyurdu: «Ey oğul! Mən sənə bir neçə kəlimə öyrədəcəm. Allahı qoru ki, Allahda səni qorusun. Allahı qoru ki, onu öz qarşında tapasan. Bir şey dilədikdə, Allahdan dilə. Kömək istədikdə yenə də Allahdan kömək istə. Bunu da bil ki, əğər bütün insanlar sənə xeyir vermək üçün bir yerə yığışsalar da belə Allahın yazdığından artıq sənə heç bir xeyir verə bilməzlər. Bunu da bil ki, əğər sənə zərər vermək üçün bir yerə yığışsalar da yenə də Allahın yazdığından artıq sənə zərər verə bilməzlər. (Çünkü) qələmlər qaldırılmış, səhifələrin (mürəkkəbi)

---

[596] Müslim 34.

[597] Tirmizi, əl-Albani «Səhihul Cəmi» 5886, İbn Hibban 276, əl-Qudamə «Musnədu Şihab» 499,500, əl-Humeydi «Musnəd» 266

qurumuşdur» . ***«O, kəslər ki, xalq onlara: Cəmaat sizə qarşı*** *(qüvvə)* ***toplamışdır onlardan qorxun! dedikdə*** *(bu söz)* ***onların imanını daha da artırdı və onlar Allah bizə kifayət edər. O nə gözəl vəkildir! deyə cavab verdilər».*** *(Ali-İmran 173).* Əgər insan etiqad edərsə ki, hər bir xeyir Allahın əlindədir o, insan Allaha sığınar və Allahdan qeyrisinə hər hansısa bir ibadətlə yönəlməz.

***Din Olaraq Islamdan*** – razı qalan insanın tabeçilikdə kamilliyə çatdığına dəlalət edir. Yəni o, kimsə İslam və onun qanunları ilə razı qalır. Bununla da (İslam qanunları) ilə Allaha yaxınlaşır. Əgər insan İslamın din olmasından razı qalarsa başqa yola bidətlərə, təriqətlərə, məzhəblərə yönəlməz. O, təriqətlər ki, Allah tərəfindən onların düz olmasına dair heç bir dəlil yoxdur. ***«****(Allah tərəfindən)* ***açıq-aydın dəlillər gəldikdən sonra, bir-birindən ayrılan və ixtilaf törədən şəxslər kimi olmayın. Onlar böyük bir əzaba düçar olacaqlar».*** *(Ali imran 105).* ***«Allaha və onun Peyğəmbərinə itaət edin. Bir-birinizlə çəkişməyin Yoxsa qorxub zəifləyər və gücdən düşərsiniz».*** *(əl-Ənfal 46).* ***«Şübhəsiz ki, sənin firqə-firqə olub dinini parçalayanlarla heç bir əlaqən yoxdur. Onların işi Allaha qalmışdır. Allah sonra onlara nə etdiklərini xəbər verəcəkdir».*** *(əl-Ənam 159).* ***«Amma*** *(ümmətlər)* ***öz dinlərini aralarında parçalayıb firqə-firqə oldular. Hər firqə öz dininə sevinir».*** *(əl-Muminun 53).* Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in səhabələrinin kifayətləndikləri din ona da kifayətdir. İslamın din olması ilə razı qalan şəxs görürsən ki, ibadətlərdə bidətlərə yol vermir, dinində səhlənkar olmur. Allahın dinində ifrata varmır. Bu da düz olmağın mənasıdır.

***Rəsul Olaraq Muhəmməddən*** – razı qalmaq səndən Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in Peyğəmbərliyi ilə razı qalmağı tələb edir. Hər bir işdə onu nümunə götürmək, ona tabeçilikdə doğru olmağı bildirir. Çünki Rəsulullah – *sallallahu aleyhi və səlləm* – insanların ən kamili və kamil sifətlər içərisində ən ucasıdır. Onun ümməti və onun tabeçiləri ümmətlər içərisində ümmətlərin ən kamili və ucasıdır. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – və onun ümməti dünyada və axirətdə də dərəcəsi ən uca olanlardır. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in Peyğəmbərliyi ilə, risaləti ilə və həmçinin ona tabeçiliklə razı qalmaq imanı artıran ən böyük amillərdəndir. Bu işlər insanın əməlində, qəlbində düzələrsə və bununla razı qalarsa o, kimsənin imanı kamilləşir. Bəndə biləndə ki, hər hansısa bir işi Allah sevir və o, iş Allaha yaxınlaşdırır o, işdən geridə qalmaz. Və biləndə ki, hər hansısa bir əməlin üzərində davamiyyətli olmaq onu Allahdan uzaqlaşdırır və Allahın qəzəbini vacib edir o, kimsə heç vaxt o, günah üzərində israrlı olmaz. Bununla da insan imanın tamını dadır. ***«Allah möminlərə lütf və mərhəmət göstərdi. Çünki onların öz içərisindən ölərinə Allahın ayələrini oxuyan, onları*** *(pis əməllərdən)* ***təmizləyən, onlara kitabı*** *(Quranı)* ***və hikməti öyrədən bir Peyğəmbər göndərdi. Halbuki bundan əvvəl onlar açıq-aydın zəlalət içərisində idilər».*** *(Ali-İmran 164).* Allah belə bir Peyğəmbəri göndərməklə möminlərə lütf və mərhəmət göstərmişdir. ***«****(Ey ümmətim!)* ***Sizə özünüzdən bir Peyğəmbər gəldi ki, sizin əziyyətə düşməyiniz ona ağırdır, o*** *(sizin iman gətirməyinizi)* ***çox istəyir. Möminlərə şəfqətli və mərhəmətlidir».*** *(ət-Tövbə 128).* Müsəlman necə belə bir Rəsula razı qalmasın. Şəfqətli və mərhəmətli bir Rəsula. Əgər insan Allahın qulu olarsa və Rəsulullah – *sallallahu aleyhi və səlləm* – tabe olarsa Allah o, bəndəni sevər. Bəndə Rəsulullah – *sallallahu aleyhi və səlləm* – tabe olması ilə onun məhəbbəti və imanı artır. ***De ki: «Əgər Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və***

---

[598] Tirmizi 2516, əl-Albani «Səhih əl-Cəmi» 7834-cü hədis.

***günahlarınızı bağışlasın. Allah bağışlayan və mərhəmətlidir».*** *(Ali İmran 31).* Bu ayə imtahan ayəsidir. Bir qrup Allahı sevdiklərini iddia edirdilər. Allah da bu ayəni nazil etdi və onlara öz sevgisinin harada olduğunu bildirdi. Mənim sevgim Rəsulullah – *sallallahu aleyhi və səlləm* – ə tabe olmaqdadır. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Əgər Allah bir qulu sevərsə əmr edir Cəbrailə: «Şübhəsiz Allah filan qulu sevər, sən də onu sev!» deyə nida edər. Cəbrail də onu sevər. Sonra Cəbrail da səmadakıları səsləyərək: «Şübhəsiz Allah filan qulu sevir, siz də onu sevin!». Səmadakılar da onu sevərlər. Sonra da onun sözü yer üzündə məqbul (qəbul) sayılar. Əgər Allah bir qulu sevməzsə əmr edir Cəbrailə: «Şübhəsiz Allah filan qulu sevmir, sən də onu sevmə!» deyə nida edər. Cəbrail də onu sevməz. Sonra Cəbrail da səmadakıları səsləyərək: «Şübhəsiz Allah filan qulu sevmir, siz də onu sevməyin!». Səmadakılar da onu sevməzlər. Sonra da yer üzündə olan insanların qəlbində (Allah tərəfindən) o, kimsə haqqında nifrət və kin qoyular» . Sələflər deyərdilər: «Əsas məsələ o, deyil ki, sən Allahı sevəsən, əsas odur Allah səni sevsin».

Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Sizdən hər hansı bir kimsə məni uşaqlarından, valideyinlərindən və cəmi insanlardan çox sevmədikcə iman etmiş olmaz» . Abdullah b. Hişam – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – ilə birlikdə oturmuşduq. Bu an Ömər – *radıyallahu anhu* – nun əlini tutmuşdu. Ömər: «Ya Rəsulullah! Sən mənə nəfsimdən başqa hər şeydən sevimlisən!». Peyğəmbər: «***Və Min Nəfsikə Yə Umaru*** – Ya Ömər! Nəfsindən də sevimli olmalıyam!» deyə buyurdu. Ömər: «***Və Min Nəfsi*** – Nəfsimdən də!» deyincə Peyğəmbər: «Ya Ömər! İndi tamam oldu». ***«Peyğəmbər möminlərə öz nəfislərindən də yaxındır».*** *(əl-Əhzab 6)* .

Əgər iki sevgi, məhəbbət bir olarsa Rəsulullah – *sallallahu aleyhi və səlləm* – i nəfsi istədiyindən üstün tutarsa o, kimsə iman sahibidir. Yox, əgər öz istədiyini Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in istədiyindən üstün tutarsa onun imanı naqisdir. ***«Amma xeyr! Sənin Allahına and olsun ki, onlar öz aralarında baş verən ixtilaflarda səni hakim təyin etməyincə və verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan sənə tam bir itaətlə boyun əyməyincə iman gətirmiş olmazlar».*** *(ən-Nisa 65).* Allah burada and içir ki, onlar iman gətirməzlər əgər Rəsulullah – *sallallahu aleyhi və səlləm* – i hakim təyin etmədikcə və həmçinin də onu hökümlərindən qəlbdə heç bir sıxıntı duymadıqca. Elə bir boyun əymək ki, onun hökmünə qəlblərdə heç bir sıxıntı qalmasın. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – i hakim təyin etmək əhkamlarda, dinin əsslarında və dinin qollarında.

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in xidmətçisi Əbu Həmzə Ənəs b. Malik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizdən hər hansı bir kimsə özünə arzu etdiyini, qardaşı üçün arzu etmədikcə iman etmiş olmaz (Yəni: «Sizdən hər hansı bir kimsə nəfsi (istədiyini) sevdiyini qardaşı üçün (istəmədikcə) sevmədikcə iman etmiş olmaz)» .

---

599 Buxari, Müslim.

600 Buxari, Müslim, Musnəd 3/207,275,278.

601 Buxari 11/523, H. 6632.

602 Buxari 13, Müslim 45. Həmçinin də Müsəlmanın öz qardaşının haqlarını qorumasına dair: ***«Onlardan*** *(mühacirlərdən və ənsarlardan)* ***sonra gələnlər belə deyərlər: «Ey Rabbimiz! Bizi və bizdən əvvəl iman gətirmiş*** *(din)* ***qardaşlarımızı bağışla…».*** *(əl-Həşr 10).* ***«…***(Ondan) ***həm öz günhlarının, həm də mömin kişilərin və qadınların günahlarının bağışlanmasını dilə…».*** *(Muhəmməd 19).* ***«Ey Rəbbimiz! Haqq-hesab çəkilən gün məni, ata-anamı və***

Bu hədis insanın öz müsəlman qardaşlarının haqlarını yerinə yetirməyi əhatə edir. Bu da imandandır. Əgər insan özünə sevdiyini qardaşı üçün də arzu etməzsə deməli o, hələ də vacib iman gətirməmişdir. Bu kimi məsələlər iman məsələsini bəyan edir. Bu kimi hədislərdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – imanı inkar edir. Həmçinin də Allah ən-Nisa surəsinin 65-ci ayəsində imanı inkar etməklə nə qəsd edir? İmanın əsasını, yoxsa imanın kamilliyi. Əgər desək ki, burada imanın əsası qəsd olunur. Onda belə çıxır ki, özünə sevdiyini qardaşı üçün arzu etməyən kafir olur. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – i bütün insanlardan çox sevməyən kafir olur. Lakin burada qəsd olunan imanın kamilliyidir. Yəni iman kamil olmaz. Bu kimi hədislərdə kamillik qəsd olunur. Bu hədislər təkfir edici deyildir. Burada olan inkar kamilliyin inkarıdır. O, insanda imanın əsası var, lakin kamil deyildir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – sevən lakin o, dərəcəyə çatmayan kafir olmur. O, kimsə müsəlmandır. Lakin onun imanı o, dərəcəyə çatmadığına görə kamil iman sahibi deyildir. Həmçinin də Allah ən-Nisa surəsinin 65-ci ayəsində olduğu kimi hakim hökmün yalnız Allaha aid olduğunu elan edərsə və bununla da yanaşı o, hakim şəhvətlərinə, nəfsi istədiyinə uyaraq Allahın endirdiyi ilə hökm verməzsə bu insan kafir olmur. Nə qədər ki, bu insan hökmün Allaha aid olduğunu elan edirsə. Lakin etdiyi əməl Allahın endirdiyi ilə hökm vermədiyinə görə əməli küfr etmiş olur. Bu da olduqca çox təhlükəlidir. İslam ümmətindən çıxardan küfr deyildir. Həmçinin o, insana ki, Allah və Peyğəmbərinin hökmü ilə hökm verilir o, kimsə bu hökmə razı qalmalıdır. Əgər qəlbində sıxıntı duyarsa imanı naqisdir. Tam bir təslimiyyət, razılıq ilə bunu qəbul etməlidir. Əgər

---

***möminləri bağışla». (İbrahim 41).*** Əbu Darda – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Allahın müsəlman qulu qeybdə (yanında olmayan) qardaşı haqqında Allaha dua edərsə ona müvəkkil olan mələk belə deyər: «Amin! Onun üçün istədiyin xeyrin bir misli qədəri sənin üçün də olsun! (Başqa rəvayətdə: Səfvan b. Abdullah deyir ki, Şama gələrək Əbu Dardanın evinə gəldim. Lakin evində onu tapa bilmədim. Zövcəsi Ummu Darda – *radıyallahu anhə* – mənə dedi: «Sən bu gün həcc etmək istəyirsənmi?». Mən: «Bəli» dedim. Qadın: «Onda mənim üçün Allaha xeyirlə dua et!» dedi və yuxarıdakı hədisi zikr etdi» Müslim 2732,2733). Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər kim bir mömini dünya sıxıntılarının birindən qurtararsa, Allah onu Qiyamət gününün sıxıntılarının bir sıxıntısından qurtarar. Hər kim çətinliyə düşənin çətinliyini yüngülləşdirərsə, Allah da o, kimsəyə dünya və axirətdə asanlıq, yüngüllük verər. Hər kim bir müsəlmanın qüsurunu (yəni xətasını) örtərsə, Allah da dünya və axirətdə onun qüsrunu (xətasını) örtər. Qul öz qardaşına kömək etməyə davam etdikcə, Allah da ona kömək etməyə davam edər» Müslim. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Müsəlmanın digər müsəlman üzərində altı haqqı vardır. Onlar hansılardır? deyə soruşduqda Peyğəmbər: «Qarşılaşdıqda salamını almaq, dəvət etdikdə dəvətini qəbul etmək, nəsihət istədikdə nəsihət vermək, asqırıb «***Əlhəmdulilləh***» dedikdə «***Yərhəmukəllah***» demək, xəstələndikdə ziyarət etmək və vəfat etdikdə cənazəsini müşayət etmək» Müslim. Abdullah b. Amr - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «(Həqiqi) Müsəlman odur ki, onun dilindən və əlindən başqa müsəlmanlar əziyyət çəkməz, mühacir isə Allahın qadağan etdiyi şeylərdən əl çəkəndir» Buxari. Əbu Musa - *radıyallahu anhu* – rəvayət edir ki, bir gün insanlar: «Ya Rəsulullah! Kimin İslamı daha fəzilətlidir? (Başqa rəvayətdə: Hansı müsəlman daha fəzilətlidir)» deyə soruşdular. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «(O, kimsənin İslamı ki) Onun dilindən və əlindən başqa müsəlmanlar əziyyət çəkməzlər» Buxari 10,11, Müslim 40-42. ***«Sən pisliyi yaxşılıqla dəf et!».*** *(əl-Muminun 96).* ***«Yaxşılıqla pislik eyni ola bilməz.*** *(Ey mömin kimsə)* ***sən pisliyi yaxşılıqla dəf et! Belə olduqda aranızda düşmənçilik olan şəxsi sanki yaxın bir dost görərsən! Bu yalnız*** *(dünyada məşəqqətlərə)* ***səbr edənlərə verilir və yalnız böyük ismət sahiblərinə əta olunur».*** *(Fussilət 34-35).* ***«Rəhmanın bəndələri o, kəslərdir ki, onlar yer üzündə təmkinlə, təvəzökarlıqla gəzər, cahillər onlara söz atdıqları zaman onlarla gözəl, yumşaq danışarlar».*** *(əl-Furqan 63).* Numan b. Bəşir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sən görürsən ki, necə müsəlmanlar bir-birlərinə olan mərhəmətlərinə, məhəbbətlərinə və şəfqətlərinə görə bir vücuda (bədənə) bənzəyirlər. O, vücuddan bir üzv xəstələnərsə bütün vücudda bu xəstəlikdən yuxusuz və hərarətdə olar» Buxari 6011, Müslim 2586. Əbu Musa - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* –buyurdu: «Möminin digər bir mömin olan bağlılığı dayaqları bir-birinə keçrilmiş bir bina kimidir. Sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – əllərinin barmaqlarını bir-birinə keçirdi» Buxari 6026,6027, Müslim 2585. ***«Şübhəsiz ki, Allah öz yolunda möhkəm divar kimi səff çəkib döyüşənləri sevər!».*** *(əs-səff 4).* ***«Həqiqətən möminlər qardaşdılar. Buna görə də iki qardaşınızın arasını düzəldin və Allahdan qorxun ki, bəlkə rəhm olunasınız».*** *(əl-Hucurat 10).*

mızıldanarsa deməli imanı naqisdir. Bu da onu göstərir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – hakim təyin etmək sadəcə hökm məsələrində deyil, bu həmçinin də əqidə, əxlaq, ibadət məsələlərində hakim təyin etməkdir. Bu da dəlildir ki, iman artır və azalır. Həmçinin iman əhli də öz aralarında fərqlənirlər.

Əbu Amr - Əbu Amra da deyilmişdir - Sufyan b. Abdullah -*radıyallahu anhu* – rəvayət edir ki, mən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən soruşdum: «Ey Allahın Rəsulu! Mənə İslama aid elə bir söz de ki, bu haqda səndən başqa heç kimə sual verməyim». (Peyğəmbər) buyurdu: «De: "Allaha iman etdim" və düz dur» . Bu hədisdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – qısa da olsa əhatəli bir tövsiyə verir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurur: «Mənə heç bir Peyğəmbərə verilməyən altı şey verilmişdir ki, onlardan biri də ***Cəvamiul Kəlim*** kəlimələrin cəmi mənə verilmişdir. Az sözlə çox mənanı əhatə edən kəlimələr» . ***Şübhəsiz ki: «Rəbbimiz Allahdır!» deyən, sonra da düz olan kəslərə*** *(ölüm ayağında)* ***mələklər nazil olub belə deyəcəklər: «Qorxmayın və kədərlənməyin! Sizə vəd olunan Cənnətlə sevinin! Biz dünyada və axirətdə də sizin dostlarınızıq. Orada*** *(Cənnətdə)* ***sizin üçün nəfslərinizin çəkdiyi, istədiyiniz hər şey vardır. Bağışlayan və rəhm edən Allahdan ruzi alarıq».*** *(Fussilət 30-32).* ***«****(Yə Muhəmməd!)* ***Sənə əmr edildiyi kimi düz*** *(yolda)* ***ol…».*** *(Hud 112).* ***«Şübhəsiz ki: «Rəbbimiz Allahdır!» – deyənlərin, sonra da*** *(sözünün üstündə)* ***möhkəm duranların*** *(qiyamət günü)* ***heç bir qorxusu yoxdur və onlar qəmm-qüssə də görməyəcəklər! Beləléri Cənnətlikdirlər, onlar*** *(dünyada)* ***etdikləri yaxşı əməllərin əvəzi olaraq orada qalacaqlar».*** *(əl-Əhqaf 13,14).* Sufyan b. Abdullah - *radıyallahu anhu* – soruşduqda elə bir məsələ haqqında soruşur ki, Rəbbinə qovuşanadək ona kifayyət etsin. Sələflər deyərdilər: «Ən gözəl kəlam az olub faydası çox olan kəlamdır». Uca Allah Rəsuluna və ona tabe olanlara hikmət dolu şəriətə uyğun olaraq istiqamət üzərə yürümələrini əmr etmişdir. Çünki Uca Allahın bizlərə uymağı əmr etdiyi din elə budur. Bundan uzaq olan, heç bir dəlilə əsaslanmayan insanların sözləri isə nə din ola bilir, nə də bir dəlil. ***«****(Ya Peyğəmbər!)* ***Buna görə də sən*** *(xalqı tövhid dininə)* ***dəvət et və sənə əmr edildiyi kimi*** *(bu yolda)* ***düz dur. Onların nəfslərindən gələn istəklərə uyma…».*** *(əş-Şura 15).* ***«Əgər onlar o, yolda doğru düzgün olub sabit qalsaydılar, biz onlara bol yağış verərdik».*** *(əl-Cinn 16).* Qurtubi – *rahmətullahi aleyhi* – deyir ki: «Əgər bu kafirlər iman gətirmiş olsalardı dünya həyatında onlara geniş ruzi verərdik və ruzini onlara yayardıq» . İbn Abbas və Qatadə – *rahmətullahi aleyhi* – deyirlər ki: «***İstiqamət –*** Allahın fərzlərini yerinə yetirmək üzərə doğru yerimək deməkdir». Qadi İyad - *rahmətullahi aleyhi* – deyir ki: «Uca Allaha tövhid etdilər, Ona ibadət etdilər, sonra da doğru yürüdülər. Tövhiddən əsla sapmadılar. Uca Allahın itaətinə, bu halda vəfat edənə qədər davam edib durdular» . Səlləm b. Miskin, Allahın Fussilət 30-cu ayəsini oxuduqdan sonra demişdir: «Sizlər müsəlmanlar olaraq «Rəbbimiz Allahdır» deyirsiniz. O, halda Rəbbimizin istiqamət üzərə olmamız haqqındakı əmrini də yerinə yetirin. Şübhəsiz bu

---

[603] Müslim 38, (Başqa rəvayətdə: Sufyan b. Abdulla - *radıyallahu anhu* – ikinci sualını verərək soruşur ki, Ya Rəsulallah! Sən məni ən çox nədən çəkindirirsən?» Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dilini tutaraq buyurdu: «Bundan!».

[604] Müslim 523.

[605] Təfsir Qurtubi 19/17.

[606] Qadi İyad 476 bəzilərinə görə isə 544 hicri. Adı İyad b. Musa b. İyaddır. Kunyəsi Əbul Fədldir. Əslən Əndəlusdandır. Maliki məzhəbindəndir.

[607] Müslim şərhi 1/213.

da Allahın əmr və qadağalarına riayət etmək və Allah Rəsulunun Sünnətinə uymaqla olur. Müsəlmanlar! Əmr olunduğunuz kimi istiqamət üzərə olun! Çünki istiqamə – bir müsəlman olaraq sənin islam üzərində sabit olmağın və sağa, sola sapmamağındır. Doğru yoldan ayrılmamağıdır. Rəsulullahın sünnəsindən kənara çıxmamağındır» . Osman b. Hadir əl-Əzdi deyir ki, bir gün İbn Abbas - *radıyallahu anhu* – nun yanına getdim və mənə bir neçə vəsiyyət etdi: «İstiqamə üzərə ol, sünnətə bağlan və ibtida etmə – yəni heç bidət etmə!» . Əbu Hureyrə – *radıyallahu anhu*– rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Əlinizdən gəldiyi qədər doğru və istiqamət üzərə əməl etməyə çalışın. Sizdən heç bir kimsəni əməlləri qurtarmayacaqdır (Cənnətə salmaz, atəşdən də qurtarmaz)». Səhabələr: «Ya Rəsulullah! Səni də mi? (əməlin qurtarmayacaqdır?) deyə soruşdular. Peyğəmbər: «Məni də əməlim qurtarmaz. Əgər Rəbbim məni öz lütfü və rahməti ilə örtüb bürüməsə» deyə buyurdu .

Qulun istiqamət üzərə olması üçün ən böyük orqanizim qəlbdir. Çünkü bütün orqanların hökmüdarı odur və qəlbin istiqamət üzərə olmasıyla digər bütün orqanlar da istiqamət tapır. Qəlbin pozulması ilə birlikdə digər orqanlar da pozulur. İbn Həcər – *rahmətullahi aleyhi* – deyir ki: «Qəlbin bu cür olması onun bədənin əmiri olmasına görədir. Əmirin düzəlməsi ilə ətrafdakılar da düzəlir. Əmrin pozulması ilə ətrafdakıların da pozulması üzə çıxır» . Əgər qəlb xəstə olarsa o. istiqamətdən də yayınar. Qəlblərin xəstə olması onları şirk, küfr, münafiqlik, həsəd, riya və s. ilə dolu olmasına görədir. ***«Onların ürəyində nifaq və həsəd mərəzi vardır. Allah onların mərəzini daha da artırar. Yalan dedikləri üçün onlar şiddətli bir əzaba düçar olacaqlar».*** *(əl-Bəqərə 10).* ***«Onların qəlbində xəstəlikmi vardır?».*** *(ən-Nur 50).* ***«Yoxsa qəlblərində mərəz olanlar elə güman etdilər ki, Allah onların*** *(ürəklərindəki)* ***kin-kudurətini zahirə çıxartmayacaqdır».*** *(Muhəmməd 29).*

Qəlbdən sonra ən çox qorunması lazım olan orqan dildir. Çünki qəlbin gizlətdiklərini ifadə edən odur. Kimi zaman sahibi tərəfindən ölçüb biçilməyərək söylənən və dildən çıxan bir söz dünyada da, axirətdə də insanın həlakına səbəb təşkil edə bilir. İnsanları cəhənnəmə götürən şey də elə dilin özüdür. ***«Dediyi hər sözü*** *(yazmaq üçün)* ***onun yanında hazır durub gözləyən*** *(iki mələk)* ***vardır».*** *(Qaf 18).* ***«****(Ey insan!)* ***Bilmədiyin bir şeyin ardınca getmə*** *(bilmədiyin bir sözü demə. Bacarmadığın bir işi görmə).* ***Çünki qulaq, göz və qəlb bunların hamısı sorğu-sual olunacaqdır».*** *(əl-İsra 36).* Səhl b. Sad – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim iki çənəsi ilə ayaqlarının arasındakını mənə zəmanət verərsə, mən də ona Cənnəti zəmanət verərəm» . Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *səllallahu aleyhi və səlləm* – buyurdu: «Bir kimsə heç bir əhəmiyyət vermədən Allahın rizasına uyğun bir söz söyləyər və onun səbəbi ilə Allah da onun dərəcələrini yüksəldər. Yenə də bir kimsə heç bir əhəmiyyət vermədən Allahın qəzəbləndirəcək bir söz söyləyər və onun səbəbi ilə Cəhənnəmə yuvarlanar» . Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *səllallahu aleyhi və səlləm* – buyurdu: «Adəm oğlu hər səhər yuxusundan oyandıqda bütün bədən üzvüləri dilə deyərlər. Bizə görə Allahdan qorx. Həqiqətən də biz səndən aslıyıq. Əgər sən düz

---

[608] İbn Batta «əl-İbanə» 1/318.
[609] İbn Batta «əl-İbanə» 1/313.
[610] Müslim 2816,2817.
[611] Fəthul Bəri 1/137.
[612] Buxari 7/184.
[613] Buxari, əl-Albani «Mişkətul Məsabih» 4813.

dursan biz də düz olarıq. Yox əgər sən əyilsən biz də əyilərik» . Muaz b. Cəbəl – *radıyallahu anhu* – rəvayət edir ki, mən: «Ey Allahın Rəsulu, mənə məni Cənnətə aparan və Cəhənnəmdən uzaqlaşdıran bir əməl haqqında danış». Pəyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sən çox əzəmətli bir şey haqqında soruşdun. Bununla belə Allahın asanlaşdırdığı kimsə üçün bu şübhəsiz ki, çox asandır. Allaha, heç bir şeyi şərik qoşmadan ibadət et, namaz qıl, zəkat ver, Ramazan orucunu tut və Kəbəni həcc et». Sonra (Peyğəmbər) buyurdu: «Sənə xeyrin qapılarnı göstərimmi? Oruc bir qalxandır, sədəqə su odu söndürdüyü kimi günahları söndürür. Bir də kişinin gecə yarısı qıldığı namazı». Sonra bu ayəni oxudu: ***«Onlar ibadət üçün yataqlarından qalxar. Heç kəs bilməz».*** *(əs-Səcdə 16-17).* Sonra buyurdu: «Sənə hər bir seyin əsasından, dirəyindən və zirvəsindən xəbər verimmi?» Mən dedim: «Bəli, ey Allahın Rəsulu!». O, buyurdu: «Hər bir işin başı İslamdır, dirəyi namazdır, zirvəsi isə Cihaddır». Sənə bunlara nə ilə nail olmağı deyimmi? Mən də: «Bəli, ey Allahın Rəsulu!» dedikdə dilini tutub buyurdu: «Buna lazımınca sahib ol! Mən dedim: «Ey Allahın Rəsulu! Biz dediyimiz sözlərə görə sorğu-sual olunacağıq?» (Peyğəmbər) buyurdu: «Qoy anan səndən məhrum olsun! İnsanları üzü üstə və ya burunları üstə Cəhənnəmə (sürükləyən) salan dillərindən başqa bir şeydirmi?» . ***«Ey iman gətirənlər! Etməyəcəyiniz bir şeyi niyə deyirsiniz. Etməyəcəyiniz bir şeyi demək Allah yanında böyük qəzəbə səbəb olar».*** *(əs-Səff 2,3).*

Həsənul Bəsri – *rahmətullahi aleyhi* – deyir ki, iman arzularla, xəyallarla və bəzənməklə olmur. İman qəlbdə olub əməllərlə həyata keçən şeydir. Kim xeyir deyib və xeyir edərsə ondan bu qəbul olacaqdır. Yox əgər kim xeyir deyib və şərr edərsə ondan bu qəbul olunmaz» . İnsanın arzu etməsi, sadəcə sözləri tələffüz etməsi ardınca əməlin gəlməməsi bu naqis iman adlanır. İman deyildir ki, sən deyəsən ki, mən elm öyrənirəm, Allah yolunda vuruşacağam, mal xərcləyəcəyəm və s. Bu sözlərdən sonra isə elm öyrənmirsən, mal xərcləmirsən, Allah yolunda da vuruşmursan. Sadəcə bu sözləri deyirsən. Lakin təsdiq etmirsən. Kamil iman odur ki, imanın əsası insanın qəlbində olur (yaxşı niyyətlər və s). Sonra da bunu əməl etməyə başlayaraq gücləndirər. Buna görə də iman arzu və xəyallarla olmaz. Belə bir iman kamil iman sayılmaz.

Bəzənməklə də iman olmur. Yəni elm, fəzilət əhlinin paltarını geyinir ki, bu da ondan susmağı, ağır olmağı, gözəl əxlaqlı olmağı tələb edir. Lakin əksinə onda iman elmi, imanın tələb etdiyi əməldən heç bir şey yoxdur. İman bəzənməklə, paltar geyinməklə gəlmir. İman elə bir şeydir ki, onun əsası qəlbdə olur. Sonra isə təsiri zahiri əməllərə keçir. Əzalarda özünü büruzə verir. İman elə bir şeydir ki, onun əsli qəlbdə olur. Sonra isə təsiri əzalara zahirə keçir. Həqiqətən iman odur ki, elm üzərində ola, ona əməl edə sonra iman sahibi imanını elm və əməl tərəfdən kamilləşdirər. Bunları kamilləşdirməyə səy göstərər və nəfsinə qarşı vuruşar. Bütün bu dəlillər imanın həqiqətini (kamilliyini) sübut edir. Əməllər isə artıq sənin qəlbində olanı təsdiqləyir.

Möhtərəm müsəlman bacı və qardaşlarım! Ayə və hədislərdən bizə aydın olur ki, iman həm artır, həm də azalır. Bununla biz müxalif olanlara (imanın nə artıb, nə də əskildiyini deyənlərə) cavab vermiş oluruq.

---

[614] Tirmizi, əl-Albani səhih.
[615] Tirmizi 2616, əl-Albani «Səhih əl-Cəmi» 29-30.
[616] İbn Teymiyyə «Kitabul İman».

# İMANI ARTIRAN VƏ AZALDAN SƏBƏBLƏR

Allah imanı gücləndirərək qüvvətləndirən bir çox yolu göstərmiş və onu artıran bir çox səbəbləri də yaratmışdır. Qul bunları etdiyi zaman yəqinliyi güclənir, imanı artır, dünya və axirətdəki dərəcəsi artır. İman indiki və gələcəkdəki hər bir xeyrin səbəbidir. Mömin qul bunu özündə müşahidə edə bilər. Görürsən ki, vaxtaşırı əməlləri güclü və çox olduğundan köksündə imanın artmasını hiss edir. Bütün bunlar da imanın artıb, azalmasına görədir. Bu ümmətin ən xeyirli insanları imanları ilə məşğul olanlar öz imanlarını vaxtaşırı yoxlayar və imanlarını artırmağa çalışardılar. İmana zidd olan, mane olan şeyləri isə dəff etməyə çalışardılar. Elm məclislərində iştirak etdikcə, zikri, duanı çoxaltdıqca görürsən ki, köksü açılır, qəlbində rahatlıq hiss edir ki, bu da imanın əlamətidir. İmanın artırılması üçün bir çox yollar vardır: 1) İnsan bilməlidir ki, iman nə kimi şeylərdən alınır, 2) İmana zidd, mane olan şeyləri bilməlidir ki, onları dəff etsin, 3). Allahdan imanının sabitliyini və artırılmasını istəməlidir.

İman nə kimi şeylərdən alınır. Bununla maraqlanmağa zərurət olduqca böyükdür. İman bəndənin kamilliyidir. İman sayəsində bəndənin həm dünyada, həm də axirətdə dərəcələri qalxır. Həmçinin də iman bəndənin bu dünyada və axirətdə xeyir yoludur. Allah hər bir tələb olunan şey üçün ona aparan yol, səbəb qoymuşdur. İman da insanın tələb etdiyi şeylər içərisində ən mühümüdür. Allah bu imanı cəlb etmək üçün güclü əsas, yollar qoymuşdur. İmam Əbul Həsən əl-Əşari sələfin üzərində icma etdiyi əsaslardan bəhs edərkən deyir: «Onlar imanın itaətlə artdığına və günahlarla azaldığına icma etmişlər» . əl-Humeydi dedi ki, İbn Uyeynənin belə dediyini eşitdim: «İman söz və əməldir, artar və əskilər». Qardaşı İbrahim b. Uyeynə ona dedi: «Ya Əbu Muhəmməd! İman artar və əskilər demə!» İbn Uyeynə qəzəblənərək: «Sus ey uşaq! Bəli, o qədər əskilər ki, ondan heç bir şey də qalmaz» . İbnu Əbi Zameneyn – *rahmətullahi aleyhi* – deyir ki: «İmanın dərəcələri və mərtəbələri vardır. Tam olur, artar və əskilər. Əgər belə olmasaydı insanlar iman məsələsində bərabər olardılar. İrəli gedənin və geri qalanın bir üstünlüyü olmazdı» . Əbu Hənifə – *rahmətullahi aleyhi* – deyir ki: «İman artmaz və azalmaz» . İmamın bu sözü doğru olmaqdan uzaqdır. Lakin hər iki halda o, əcr qazanmışdır. Çünki hər bir insan əməl etdiyi zaman qəsdi Allah və Rəsuluna itaət olubsa və bu əməlində xəta etmişsə, təvil etmişsə Allah üçün itaət qəsd edərək etmişsə o, kimsə bu əməlində bağışlanır, qəsdi Allah üçün olduğuna görə savab qazanır. Allah onun etdiyi əməli əvəzsiz qoymur. ***«Ey Rəbbimiz! Unutduqda və ya yanıldıqda bizi cəzalandırma! Ey Rəbbimiz! Bizdən əvvəlkiləri yüklədiyin kimi, bizi ağır yükləmə! Ey Rəbbimiz! Gücümüz çatmayan şeyi bizə yükləyib daşıtdırma! Bizi əfv edib bağışla, bizə rəhm et! Sən bizim ixtiyar sahibimizsən. Kafirlərə qələbə çalmaqda bizə kömək et!».*** *(əl-Bəqərə 286).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: Hakim hökm verəcəyi zaman ictihad edər və sonra (hökmündə doğru) olarsa iki əcr qazanır. Hökm edəcəyi zaman ictihadında yanılırsa ona da bir əcr vardır» . İbn Əbdil Bərr və İbn Əbil İzz –

[617] əl-Əşari «Risalərun ilə əhlis sağir» s. 272, Təhqiq – Abdullah Şakir əl-Cundi.
[618] əl-Acurri «Kitabuş Şəria» 2/607 (244).
[619] İbn Əbu Zemeneyn «Usulu Sünnə» s. 207.
[620] əl-Vəsiyyət şərhi s. 3.
[621] Buxari 7352, Müslim 1716.

*rahmətullahi aleyhi* – deyir ki: «Əbu Hənifə – *rahmətullahi aleyhi* – bu görüşündən döndüyünü nəql etmişdir. Doğrusunu bilən isə Allahdır» .

1. Allahın kitabından və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sünnəsindən istifadə edərək faydalı elm öyrənmək üçün səyy göstərmək və öyrəndiklərini həyata keçirmək. Kim bunlarda tələsərsə imanın artmasının ən böyük səbəbini əldə etmiş olar. ***«Rəbbim mənim elmimi artır!».*** *(Ta ha 114).* ***«Heç bilənlərlə bilməyənlər eyni olurmu?».*** *(əz-Zumər 9).* ***«Allahdan qulları içində ancaq alimlər qorxar».*** *(Fatir 28).* Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər kim elm öyrənmək qayəsi ilə yola çıxarsa Allah onun Cənnətə gedən yolunu asanlaşdırar» . Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bu üç şey müstəsna olmaqla Adəm oğlu öldükdə əməli kəsilir. Faydalı elm qoyub getmək (hansı ki, insanlar ondan istifadə edirlər). Xeyirli sədəqə (yol saldırmaq, su çəkmək). Sənin üçün dua edən saleh övladlar» . Əbu Darda - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər kim elm öyrənmək üçün müəyyən bir yola çıxarsa Allah onun Cənnətə gedən yolunu asantlaşdırar. Mələklər elm tələbəsinin etdiyi bu əməlindən xoşlandıqlarına görə qanadlarını açarlar. Göylərdə və yerdə olan hər bir şey elm öyrənən üçün istiğfar diləyərlər. Hətta suda yaşayan kit balığıda (Başqa rəvayətdə: Qarışqalar da). Alimin ibadət əhli üzərindəki fəziləti ayın digər ulduzlar üzərindəki üstünlüyü kimidir (Başqa rəvayətdə: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mənim sizin mərtəbə baxımından ən aşağı olanınız üzərindəki fəziləti kimidir»). Şübhəsiz ki, alimlər Peyğəmbərlərin varisləridirlər. Peyğəmbərlər isə özlərindən sonra nə dinar, nə də dirhəm miras buraxmırlar. Buraxdıqları yalnız elmdir. Hər kim də bu (elmdən) bir pay əldə edərsə ona böyük bir nemət verilmişdir» . Muaz b. Cəbəl - *radıyallahu anhu* – rəvayət edir ki: «Elm öyrənin! Həqiqətən də elmi Allah xatirinə öyrənmək təqvadır, elm tələb etmək ibadətdir, elmi müzakirə etmək təsbihdir, elmi axtarmaq cihaddır, bilməyənlərə elmi öyrətmək sədəqədir. Çünki məhz elm halal və haramın öyrənilməsi üçün səbəbdir, Cənnət əhlinin yolunu işıqlandıran nurdur, vəhşilər arasında insandır, qəriblikdə isə dostdur, xəlvətdə sənə həmdəmdir, sevinc və kədərdə sənə yol göstərən vasitə, düşmənlə mübarizədə silah, dostlar yanında zinnətdir. Onunla Allah bir qism insanları xeyir nəsib edər, onları aparıcı qüvvəyə çevirər və digərləri də onların ardıyca gedər, mələklər onları sevər və onları əhatə edər. Hər bir canlı və cansız onlar üçün bağışlanma diləyər. Hətta dənizdəki balıqlar və quruda yaşayan heyvanlar da. Elm qəlbləri cəhalətdən oyadar, gözləri də zülmətdən nura açar. Bəndə elmin fəziləti ilə ən xeyirli insanların dərəcəsinə çatar, dünya və axirətdə olan ən yüksək məqamlara nail olur. Elmdə təfəkkur orucu, müzakirə etmək isə qiyamı (gecə ibadətlərini) əvəz edər. Onun vasitəsi ilə qohumluq əlaqələri möhkəmlənir. Elm hər bir əməlin imamı hesab olunur və əməl də ona tabe olur. Elmə nail olan insan xoşbəxt, ondan məhrum olan isə bədbəxt olar» . Sələflər deyrilər ki: «Elm özü gəlmir, elmə nail olmaq üçün ona tərəf getmək lazımdır» . Həsənul Bəsri - *radıyallahu anhu* – rəvayət edir ki: «Uşaqlıq çağlarında öyrənilən elm daş üzərində

---

[622] İbn Əbdil Bərr «Təhmid» 9/247, «Şərhu Əqidətul Tahaviyyə» s. 395.
[623] Müslim 2699.
[624] Müslim 1631.
[625] Əbu Davud 3641, Tirmizi 2683.
[626] Cəmi Bəyanul Elm və Fədlihi 1/52.
[627] Məalimu fi Tariqi Taləbil Elm s. 23.

oyulmuş naxışlara bənzəyir» . Ömər - *radıyallahu anhu* – rəvayət edir ki: «Evlənməmişdən öncə elm öyrənin» . Sələflər deyərdilər: «Elmi beşikdən qəbr (ləhd) evinə kimi tələb et!». Əli - *radıyallahu anhu* – rəvayət edir ki: «Haqq kişilərə görə tanınmır, kişilər haqqa görə tanınırlar. Haqqı bil ki, ona əməl edənləri də tanıyasan». Əli - *radıyallahu anhu* – rəvayət edir ki: «Ey elm əhli! Elmə əməl edin. Alim odur ki, bildiyinə əməl edə, elmi əməlinə müvafiq olandır. Elə qövmlər olacaq ki, onlar elmi daşıyacaqlar. Lakin bu elm onların boğazlarından keçməyəcəkdir. Dedikləri əməllərinə zidd olacaqdır. Daxilləri zahirlərinə zidd olacaqdır. Onlar dəstə-dəstə oturacaqlar bir-birlərinə qarşı öyünəcəklər. Hətta onlardan bir onları tərk edib başqa məclisə getdikdə qəzəblənərlər. Onlar o, kəslərdir ki, onların əməlləri o, məclislərdən yuxarı qalxmayacaqdır». Mucahid - *radıyallahu anhu* – rəvayət edir ki: «Nə utanan, nə də təkəbbürlü olan şəxs elmə yiyələnə bilməz» .

2. Quran və Sünnədən keçən Allahın gözəl İsimlərini öyrənmək, onların mənalarını başa düşməkdə və onlarla ibadət etməkdə arzulu və həris olmaq. İnsanın nə qədər Allahın İsim və Sifətləri barəsində biliyi artarsa onun bir o, qədər də imanı və yəqinliyi güclənər. Hər bir möminə vacibdir ki, Allahın İsim və Sifətlərini bilməyə calışsın. Hətta bu işdə sabit olsun. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Mətləblərin ən ucası və qayələrin ən böyüyüdür. Nəfslərin bilmək istədikləri və yönəldikləri şeylər içərisində ən şərəflisidir. Allahın İsim və Sifətlərini bilmək hidayətin əsasıdır». Bu adları bilmək, bu adların nə kimi sifətlərə dəlalət etməsini bilmək. Çünki hər ad sifətə dəlalət edir, sifətlər isə ada dəlalət etmir. Allahın hər bir İsminin qəlbdə müəyyən bir təsiri vardır. Həmçinin də Allahın adlarından hər hansınısa bilməmək, və ya onların biliyi barəsində zəlalətə düşmək Allah barəsində pis zənnə gətirib çıxardır. Əgər hər bir adın öz təsiri vardısa, bu adları bilməməyin, bu adlar barəsində azmağın artıq əks təsiri olur. Bu da cahillikdir. Cahillik isə öldürücü xəstəlikdir. İnsanın qəlbi düzəlməz Allahın adları barəsində elmini gücləndirməsə. Əgər insan Allahın adlarından bəziləri-ni bilərsə və bəzilərini bilməzsə artıq onun qəlbində bildiyinə görə qəlbi düzələr, bilmədiyinə görə isə qəlbində zəlalət olar. Bu da çox əzəmətli və şərəfli bir işdir.

3. Allahın nazil etdiyi Quran ayələrini oxumaq və onun üzərində düşünmək. ***Tədəbbür*** – oxumaq, öyrənmək və başa düşməkdir. Quranı düşünərək və başa düşərək oxuyan kimsə özündə imanın qüvvətləndiyini hiss edəcəkdir. Bunu yalnız Quranı başa düşərək, yaşayaraq əldə edə bilər. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir topluluq Allahın evlərindən birində toplanıb, Allahın kitabını öyrənər (oxuyar) və öz aralarında onu müzakirə edərlərsə onlara Allah tərəfindən sakitlik enər, Allahın rəhməti onları örtər, mələklər onları əhatəyə alarlar, Allah onları öz dərgahında olanların yanında yad edər. Hər kim (bu) əməlləri gecikdirəcək olursa, nəticəsi onu irəli hərəkət etməyə qoymaz (geri düşər)» . İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki: «Bizdən birimiz **10** ayə öyrəndikdən sonra, onların mənasını dərk edib əməl etmədikcə başqa ayə öyrənməzdik. Elmlə əməli birləşdirərdik» .

4. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in həyatını oxumaq, onun uca əxlaqını, mükəmməl özəlliklərini öyrənmək. Çünki onun həyatını öyrənən və incələyən kimsə

---

[628] Cəmiul Bəyanul Elm və Fadluhu s. 99.
[629] Fəthul Bəri 1/991.
[630] Fəthul Bəri 1/276.
[631] Müslim 2699.
[632] İbn Kəsir 1/2

özü üçün bir çox xeyiri və gözəlliyi qazanmış və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə olan sevgi və inancı artar. Bu sevgi və inanc Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in izindən getmək və sünnəti ilə əməl etməklə olur.

5. İslamın gözəlliklərini düşünmək. Çünki İslam dini tam bir gözəllikdən ibarətdir. Onun əqidələri digər dinlər və inanclar arasında ən gözəl, ən faydalı və ən doğrusudur. Onun hökümləri qullar üçün ən gözəl və ən adil hökümlərdir. Onun ortaya qoyduğu əxlaq, kəsin olaraq ən gözəl və ən mükəmməl əxlaqdır. Bütün bunlar haqqında düşünmək insanın qəlbində imanı gücləndirir və ona imanı sevdirir. Beləcə imanın dadına və tamına varır.

6. Allahın Kovni ayətlərini, yaratdıqlarını düşünmək. Göylərin, yerin və onlardakı olan yaradılmışların böyüklüyü, insanın özünün sahib olduğu gözəllikləri düşünmək insanın qəlbində imanın artmasına və kök salmasına səbəbdir. ***Təfəkkur*** – insanın bir nəticəyə çatması üçün fikrini işlətməsinə deyilir. Təfəkkur – həm mömin, həm imanı zəiflər üçün, həm də kafirlər üçün buyrulmuşdur. Kafir təfəkkur etməklə imana gələr, imanı zəif olan imanını artırar, mömininin isə imanının üstünə iman artar. ***Təfəkkur*** – ibadətdir. ***«Həqiqətən göylərin və yerin yaradılması, gecə ilə gündüzün bir-birini əvəz etməsi ağıl sahibləri üçün qəti dəlillərdir. O, kəslər ki, ayaq üstə olanda da, oturanda da, uzananda da Allahı xatırlar, göylərin və yerin yaradılması haqqında düşünər*** *(və deyərlər)****: «Ey Rəbbimiz! Sən bunları boş yerə yaratmamısan! Sən pak və müqəddəssən! Bizi Cəhənnəm odunun əzabından Özün qoru!».*** *(Ali İmran 190,191).* ***«Məgər onlar başlarının üstündə qanad açıb uçan, sonra da qanadlarını yığan quşları görmürlərmi. Onları havada saxlayan ancaq Rəhmandır. Həqiqətən O hər şeyi görəndir».*** *(əl-Mulk 19).*

7. Allahı çox zikr və dua etmək. Çünki bu qulun Uca Rəbbinə bağlanmasının ən önəmli səbəblərindəndir. Bu iman ağacını qəlbə əkər, bəslər və qüvvətləndirər. ***«Mənə dua edin, Məndə sizin dualarınızı qəbul edim».*** *(əl-Muminun 60).* ***«Məni xatırlayın ki, mən də sizi yada salım. Mənə şükr edin, kafir olmayın».*** *(əl-Bəqərə 152).* ***«Ey iman gətirənlər! Allahı çox zikr edin».*** *(əl-Əhzab 41).* ***«Öz qəlbində yalvararaq və qorxaraq səsini çox ucaltmadan səhər və axşam Rəbbini xatırla və qafillərdən olma».*** *(əl-Əraf 205).* ***«Əgər bəndələrim səndən Məni soruşsalar – mən onalra yaxınam. Dua edib Məni çağırana cavab verərəm. Gərək onlarda Mənim çağırışıma cavab verib iman gətirsinlər. Bununla belə doğru yola yetişərlər».*** *(əl-Bəqərə 186).* ***«O, kəslər ki, nə alış-veriş onları Allahı zikr etməkdən…yayındırmaz».*** *(ən-Nur 37).* ***«Allahı zikr etmək heç şübhəsiz ki, bu daha böyükdür».*** *(əl-Ənkəbut 45).* ***«Rəbbinin camalını diləyərək səhər-axşam Ona dua edənləri yanından qovma. Onların əməllərinin sənə, sənin əməllərinin isə onlara heç bir dəxli yoxdur. Buna görə də zalımlardan olarsan».*** *(əl-Ənam 52).* Əbu Musa əl-Əşari – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allahı zikr edən ev ilə, zikr etməyən evin fərqi ölü ilə diri arasında olan fərqdir (Başqa rəvayətdə: Allahı zikr edən ilə etməyənin fərqi)»[633]. Abdullah b. Busr – *radıyallahu anhu* – rəvayət edir ki, bir nəfər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən: «Ey Allahın Rəsulu! İslamın mənə olan əmrlərini asanlaşdır. Mənə bir şeylər bildir ki, ona sımsıxı sarılım» dedi. Peyğəmbər: «Qoy dilin Allahı daima zikr etməklə islah qalsın»[634]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – öz Rəbbindən buyurdu: «Mən qulumun Mənim

---

[633] Buxari, Müslim.
[634] Səhih Tirmizi 3/139, Səhih İbn Məcə 2/317.

haqqımdakı zənnindəyəm. Məni zikr etdikcə onunlayam. (Kim Məni özündə anarsa Mən də onu Özümdə anaram). Məni bir topluluqda anarsa, mən də onu daha xeyirli bir topluluqda anaram. Mənə bir qarış yaxınlaşarsa, Mən də ona bir arşın yaxınlaşaram. Mənə bir arşın yaxınlaşarsa, Mən də ona bir qulanc yaxınlaşaram. Qulum Mənə yürüyərək gələrsə, Mən də ona qaçaraq gələrəm» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim bir yerdə oturub Allahı zikr etməzsə Allah tərəfindən (bu qüsruna görə) bir peşmançılığa uğrayarlar. Kim də bir yatağa uzanaraq Allahı zikr etməzsə Allah tərəfindən bir peşmançılığa uğrayar» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir məclisdə oturub və orada Allahı zikr etməyən və Nəbilərinə salavat gətirməyən bir topluluq mütləq Allah tərəfindən peşmançılığa uğrayarlar. Allah dilərsə onlara əzab verər, dilərsə onları bağışlayar» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Oturduğları məclisdən Allahı zikr etmədən qalxan bir topluluq eşşək leşi qabağından qalxmış kimidirlər. Bu onlar üçün peşman olacaqları bir işdir» .

8. Fərzlərdən sonra nafilələri çoxaltmaq. Çünki nafilələr qulu Rəbbinə yaxınlaşdırır. Bütün ibadətləri ən gözəl bir şəkildə etməyə çalışmaq. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah – *subhənəhu və təalə* – buyurdu: «Kim mənim dostumla düşmənçilik edərsə, mən ona müharibə elan edərəm. Qulum, üzərinə fərz qıldığım şeylərdən daha çox sevdiyim hər hansı bir şeylə mənə yaxınlaşmaz. Qulum nafilələrlə mənə yaxınlaşarsa mən onu sevərəm. Elə ki, onu sevdim, artıq onun eşidən qulağı, görən gözü, tutan əli, yürüyən ayağı olaram. Əğər məndən bir şey istəsə and olsun ki, ona verərəm. Sığınacaq istəsə onu himayəmə alaram» .

9. Sadiq möminlərin və Allahın saleh dostlarının vəsfləi ilə vəsflənmək, onların izindən getmək, onları rəhbər etmək və onlarla bərabər olmaq. Çünki bu davranış qula Rəbbini xatırladır, qəlbini yumşaldır və imanını artırır.

10. İnsanları Allaha çağırmaq, yaxşılığı əmr edib pislikdən çəkindirmək, haqqı və səbri tövsiyə etmək. ***«And olsun axşam çağına ki, insan ziyan içindədir. Yalnız iman gətirib yaxşı əməllər edən və səbri tövsiyə edən kimsələrdən başqa!».*** *(əl-Əsr).*

11. Küfrün bölümlərindən, böyük günahlardan, münafiqlik, pislik və üsyandan uzaq olmaq. Çünki bu kimi günahlar qəlbdə imanın zəifləməsinə səbəbdir.

Qulun qəlbindəki imanının azalmasına ən mühüm səbəblərdən biri də imanı artıran səbəblərdən yapışmamaq, onları etməyə səyy göstərməməkdir.

1. Dini əmrləri və şəri bilikləri bilməmək. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Elm tələb etmək hər bir müsəlmana fərzdir» .

2. Qəflətdə olmaq. ***«Biz cinlərdən və insanlardan bir çoxunu Cəhənnəm üçün yaratdıq. Onların qəlbləri vardır, lakin onunla anlamazlar. Onların gözləri vardır, lakin onunla görməzlər, onların qulaqları vardır, lakin onunla eşitməzlər. Onlar heyvan kimidirlər, bəlkə də*** *(ondan)* ***daha çox zəlalətdədirlər. Qafil olanlar da məhz onlardır!».*** *(əl-Əraf 179).*

---

[635] Buxari 8/171, Müslim 4/2061.
[636] Əbu Davud 4/264, əl-Albani «Səhihul Cəmi» 5/342.
[637] Səhih Tirmizi 3/140.
[638] Əbu Davud 4/264, Əhməd 2/389, əl-Albani «Səhihul Cəmi» 5/176.
[639] Buxari 6502.
[640] əl-Albani «Səhihul Cəmi» 3808.

3. Günahlar etmək. ***«Əgər siz inkar edilmiş böyük günahlardan uzaqlaşa bilsəniz biz sizin kiçik günahlarınızı bağışlayarıq».*** *(ən-Nisa 31).* ***«Kim ki, kiçik günahlara yol verib lakin böyük günahlardan və əxlaqsızlıqdan uzaq durarlar. Həqiqətən sənin Rəbbin böyük bağışlayandır».***

4. Pisliyi əmr edən nəfsə tabe olmaq. ***«Mən özümü təmizə çıxartmıram. Rəbbimin rəhm etdiyi kimsə istisna olmaqla nəfs pis işləri görməyi əmr edir. Həqiqətən Rəbbim bağışlayan və Rəhm edəndir».*** *(Yusif 53).*

5. Dünyaya, onun fitnələrinə və gözəlliyinə bağlanmaq. ***«Kim*** *(axirətdən vaz keçib)* ***dünya və onun bər-bəzəyini istəyirsə, biz onun əməllərinin əvəzini*** *(sağlamlıq, sərvət, övlad, gözəl yaşayışı)* ***elə dünyada ikən verərik. Onların dünyadakı mükafatları əsla azaldılmaz. Belələrinin axirətdə atəşdən başqa heç bir payı yoxdur. Onların dünyada gördükləri işlər puç olar və bütün əməlləri boşa çıxar».*** *(Hud 15-16).* ***«Qadınlar, uşaqlar, qızıl-gümüş yığınları, yaxşı cins atlar, mal-qara və əkin yerləri kimi nəfsin istədiyi və arzuladığı şeylər insanlara gözəl göstərilmişdir. Lakin bütün bunlar dünya həyatının keçici zövqüdür, gözəl dönüş yeri isə Allah yanındadır».*** *(Ali-İmran 14).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizin ən zəngininiz dinarda, dirhəmdə zəngin olanınız deyildir. Qəlbində zəngin olanınızdır» .

6. Boş və faydasız məclislərdə pis (əxlaqsız) insanlarla oturub-durmaq. ***«****(Ya Rəsulum!)* ***ayələrimizə istehza edənləri gördüyün zaman onlar söhbəti dəyişənə qədər onlardan üz çevir. Əgər şeytan*** *(bu qadağan əmrini)* ***sənə unutdursa xatırlayandan sonra o, zalım tayfa ilə bərabər oturma».*** *(əl-Ənam 68).* ***«Allah Quranda nazil etmişdir ki, Allahın ayələrinin inkar edildiyini və onlara istehza olunduğunu eşitdiyiniz zaman müşriklər başqa söhbətə girişməyənə qədər onlarla bir yerdə əyləşməyin. Çünki o, vaxt siz də onların tayı olarsınız».*** *(ən-Nisa 140).*

7. Şeytanın izindən getmək. ***«Ey iman gətirənlər! Şeytanın yolunu tutub getməyin. Kim şeytanın yolunu tutub gedərsə o, sizi çirkin və pis işləri görməyi əmr edər».*** *(ən-Nur 21).*

## İMANIN ŞÖBƏLƏRİ

İbn Həcər - *rahmətullahi aleyhi* - deyir ki, imanın şöbələrindən zikr olunan ictihadi tərəfdəndir. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «İman yetmiş yaxud da altmışdan çox şöbələrdən ibarətdir. Ən fəzilətlisi, Allahdan başqa ibadətə layiq haqq ilah olmadığını - ***Lə İləhə İlləllah*** - söyləmək, ən aşağı şöbəsi isə yolda olan maneəni dəf etməkdir. Həya da imanın bir şöbəsidir» . Bu imanın şöbələri təfsilatı ilə heç bir hədisdə və dəlildə zikr olunmamışdır. İmanın bu şöbələrini alimlər zikr ediblər bu da ictihadi tərəfdəndir. Alimlər imanın şöbələrini **63-79** arası zikr ediblər. Nə bundan çoxdur, nə də az. Bu kimi hədislərdə nə kimi hikmət vardır? Qurandan və Sünnədən bizə Allahın **99** İsim və Sifətləri məlumdur. Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurur: «Allahın doxsan doqquz – yüzdən bir əskik adı vardır. Kim bu İsimləri sayarsa Cənnətə girər . Həmçinin bu hədisdə də say zikr olunub lakin təfsilatı heç bir səhih və açıq dəlildə zikr olunmayıb. Bunun da sayılması ictihat tərəfindəndir. Bu kimi hədislərdə nə kimi

[641] Müslim.
[642] Buxari, Müslim.
[643] Buxari, Müslim.

hikmət vardır. Say zikr olunub lakin təfsilatı verilməyib. Alimlərdən bəziləri qeyd edirlər ki, bunda uca bir hikmət vardır. Allah bununla bəndələrindən özünün Kitabı və Rəsulullahın sünnəsi ilə maraqlanmağı istəyir. Onları Quran və Sünnəyə bağlamaq istəyir. Onlar öz ağıllarını bunları başa düşməkdə işlətsinlər. Əgər onlar Allahın **99** İsmini bilsələr onlarda Allah barəsində kamil bir bilik yaranar. İmanın şöbələrini isə kamil bir şəkildə bilsələr onlarda din barəsində kamil bir bilik yaranar. Bununla da onlar Allahı və Onun dinini bilib tanıyarlar. Bu da imanın kamilliyidir. Elə din özü də budur. Ola bilər ki, bundan da başqa hikmətlər vardır. Lakin bu isə uca bir hikmətdir. Həmçinin imanın şöbələrini gözəl bir şəkildə bilmək Allahın dostluğuna aparan bir yoldur. Əgər insan imanın şöbələrini bilsə artıq o, Allahın dostuluğuna aparan bir yolu bilmişdir. Bununla da bu yol onun qarşısında açıq-aydın olur. Ayağı da sabit qədəm olur. Heç bir bidətə, təriqətlərə, məzhəblərə ehtiyacı olmur.

İmanın şöbələrini bilmək üçün müəyyən qaydalar vardır. Biz nə bilək ki, bu əməl imanın şöbələrindəndir? Alimlər deyirlər ki, Allah və Rəsulunun buyurduğu hər bir əmri yerinə yetirmək imanın şöbəsi sayılır və həmçinin də Allah və Rəsulunun qadağan etdiyi hər bir işi tərk etmək də imanın şöbələrindəndir. İmanın bu şöbələri alimlərin ictihadlarına görə fərqlənə bilər. İmanın şöbələrini daha gözəl şəkildə İbn Hibban - *rahmətullahi aleyhi* – vermişdir. İbn Hibban - *rahmətullahi aleyhi* – imanın 69 şöbəsini zikr edərək deyir ki, imanın şöbələri qəlbin, dilin və bədənin əməllərindən meydana gəlir.

***Qəlbə Aid Olan Əməllər*** - bunlar etiqadlar və niyyətlərdir özü-özlüyündə **24** xisləti əhatə edir.

1. Allaha iman (Bura daxildir: Allahın zatına, sifətlərinə, tövhidə və bənzərinin olmadığına iman etmək).
2. Mələklərə iman.
3. Kitablara iman.
4. Peyğəmbərlərə iman.
5. Axirətə iman (Bura daxildir: Ölüm, dirilmək, mizan, Cənnət, Cəhənnəm və s)
6. Xeyir və Şərrin, qədərin Allahdan olmasına iman.
7. Allahı sevmək.
8. Allah xatirinə sevmək və qəzəblənmək.
9. Muhəmməd Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – i sevmək (Bura daxildir: Ona salavat gətirmək və sünnəsinə tabe olmaq).
10. İxlaslı olmaq (Bura daxildir: Riya və Nifaqı tərk etmək).
11. Tövbə etmək.
12. Təqvalı olmaq (Allahdan qorxmaq).
13. Allahın rəhmətini ummaq (ər-Rica ).
14. Şükr etmək.
15. Səbr etmək.
16. Təvəzökar olmaq (Bura daxildir: Böyüyə hörmət, balacaya rəhm etmək)
17. Vəfalı olmaq.
18. Qəza və Qədərə razı olmaq.
19. Rəhmli olmaq.
20. Qəzəbi tərk etmək.

---

[644] ***Rica*** – İnsanın əldə edilməsi mümkün olan bir şeyi ümüd etməsidir. ***«Kim Rəbbinə qovuşmağı ümüd edirsə saleh bir əməl etsin və Rəbbinə olan ibadətdə heç kəsi Ona şərik qoşmasın».*** *(əl-Kəhf 110).*

21. Həsəd, paxıllığı tərk etmək.
22. Təkəbbürlüyü tərk etmək.
23. Kin-kudurəti tərk etmək.
24. Təvəkkül.

***Dilə Aid Olan Əməllər*** - İmanın bu şöbəsi özü-özlüyündə **7** xisləti əhatə edir.

1. Tövhid kəliməsini tələffüz etmək (Şəhadət gətirmək).
2. Quran oxumaq.
3. Elm öyrənmək.
4. Elmi öyrətmək.
5. Dua etmək.
6. Zikr etmək (Bura daxildir: İstiğfar diləmək).
7. Lağlağıdan, faydasız şeylərdən uzaq olmaq.

***Bədənə Aid Olan Əməllər*** - İmanın bu şöbəsi özü-özlüyündə **38** xisləti əhatə edir.

1. Zahiri və daxili təmizlik (nəcasətdən təmizlənmək).
2. Övrətin örtülməsi.
3. Nafilə və fərz namazlarını qılmaq.
4. Zəkat vermək.
5. Oruc tutmaq (fərz və nafilə oruclarını tutmaq)
6. Əli açıq olmaq (Bura daxildir: Yemək yedirmək, qonağa hörmət etmək).
7. Qul azad etmək.
8. Həcc və Ümrə ziyarətini etmək.
9. Kəbəni təvaf etmək.
10. Qədr gecəsini ibadətlə keçirmək.
11. Etiqaf (Ramazan ayının axır **10** gününü məsciddə keçirmək).
12. Hicrət etmək (Bura daxildir: Şirk diyarından İslam yurduna köçmək).
13. Nəzirə vəfalı çıxmaq.
14. Andı qorumaq.
15. Kəffarələri ödəmək.
16. Evlənmək və ya ərə getmək.
17. Ailənin haqlarını yerinə yetirmək.
18. Ağalara itaət etmək.
19. Qul ilə mülayim rəftar etmək.
19. Valideyinlərin qayğısına qalmaq, onlara asi olmamaq.
20. Qohumluq əlaqələrini möhkəmləndirmək.
21. Uşaqları tərbiyə etmək.
22. İnsanlar arasını islah etmək (Bura daxildir: Azğınlara, din düşmənlərinə, xavariclərə qarşı mübarizə aparmaq).
23. Əmr sahiblərinə itaət.
24. Yaxşı işlərdə yardımlaşmaq (Bura daxildir: Yaxşılığı əmr, pislikdən çəkindirmək».
25. Əmanəti ödəmək.
26. Borcu ödəmək.
27. Qonşuya ikram etmək.
28. Salamı qaytarmaq.
29. Gözəl müamılədə, rəftarda olmaq (Bura daxildir: Malı halal yerdən qazanmaq).

---

[645] ***Istiğfar*** - Bağışlanma diləmək deməkdir.

30. Malı haqlı yerə xərcləmək (Bura daxildir: İsrafı tərk etmək).
31. Əyləncədən, çox oynamaqdan, boş söhbətlərdən çəkinmək.
32. Asqıraraq «***Əlhəmdulilləh***» deyənə «***Yərhəmukəllah***» demək.
33. Cəmaata tabe olmaq.
34. Ədalətlə hökm vermək (ədalətli olmaq).
35. Hər hansı bir günaha görə müəyyən cəriməni ödəmək (hədlərin tədbiq olunması).
36. Cihad etmək (Bura daxildir: Sərhəddə keşikdə durmaq).
37. İnsanlara əziyyət verməmək.
38. Yolda əziyyət verən bir şeyi yoldan kənarlaşdırmaq.

## ALLAH - *Subhənəhu Və Təalə* - nin FELİ

Zahiri və batini əməllər imanı təsdiqləyir və bu əməllərlə insanın imanı kamilləşir. ***«Kim Allaha iman gətirərsə Allah onun qəlbini haqqa yönəldər və o, dünyada baş verən hər şeyin Allahın əzəli hökmü və izni ilə olduğunu bilər. Allah hər şeyi biləndir».*** *(ət-Təğabun 11).* Bu ayədə Allahın feli (əməli) zikr olunmuşdur. Bu da imanın şöbələrindən deyildir. İnsanların əməllərinə müqabil Allah onlara ikrah edir. İnsanın imanı kamilləşərsə Allahın əməlinin təsiri ortaya çıxır. Bu da razılıq, təslimiyyət və qəlb rahatlığıdır. Lakin bu təslimiyət və razılıq Allahın felinin təsiridir. Bu ayədə imanın şöbələrindən zikr olunmur. Lakin Allahın feli insanların öz imanlarını kamilləşdirməsinə bağlıdır. Çünki Allah buyurur ki: ***«Kim Allaha iman gətirərsə Allah onun qəlbini haqqa yönəldər»*** – əgər bəndə o, səbəbi yerinə yetirərsə Allah tərəfindən mükafata layiq görülər. Həmçinin də Allahın razı qaldığı bir əməli yerinə yetirərsə Allah onun üçün dünya və axirətdə xeyir olacaq bir şeyi verər. ***«Allaha itaət edin, Onun Peyğəmbərinə itaət edin. Hər kəs üz döndərsə*** *(bilsin ki)* ***Peyğəmbərimizin öhdəsinə düşən yalnız açıq-aşkar təbliğdir».*** *(ət-Təğabun 12).*

Bu ayə müsibətlər haqqındadır. Müsibətlərin təbiəti elədir ki, şiddətli olduqda insanın qəlbi elə bil ki, yerindən qopur. İnsan özündən çıxır. Bu da onun başına gələn müsibətdəndir. Bu hal insanı zəiflədir. Bununla insan öz qəzəbinə hakim ola bilmir. Alimlər deyirlər ki, ağıl qəlbdədir. ***«Onların qəlbləri vardır lakin onunla anlamazlar».*** *(əl-Əraf 179).* ***«Şübhəsiz ki, bunda qəlb*** *(ağıl)* ***sahibi üçün, yaxud eşitdiyi zaman qulaq asan bir kimsə üçün ibrət dərsi vardır».*** *(Qaf 37).* İbn Həcər - *rahmətullahi aleyhi* – deyir ki: «Bu ayələrlə ağlın qəlbdə olmasına dəlil göstərilə dilər» . Əgər insanın ağlı zəifləyərsə onda onun hissiyatı güclənər. Özündən çıxma, qəzəblənmə ortaya çıxar. Ola bilər ki, bununla o, dininə zərər vurar. Hətta Allahın qüdrətinə, hikmətinə, qədərinə küfr edə bilər. Özünə və ya başqalarına zərər yetirə bilər. Bu da müsibətlərin ağırlığından aslıdır. Buna görə də insan müsibətlər anında çətin də olsa səbr etməlidir və qəzəbini boğmalıdır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qəzəb şeytandandır. Şeytan isə atəşdən yaradılmışdır. Atəş isə su ilə söndürülür. O, halda hər hansı biriniz qəzəbləndikdə dəstəmaz alsın» . Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Güclü insan o, kimsə deyil ki, hamıya qalib gəlir. Güclü insan qəzəbli

[646] Fəthul Bəri 1/137.
[647] Əbu Davud.

halda nəfsinə hakim olandır» . Əbu Hureyrə - *radıyallahu anhu*– rəvayət edir ki, bir nəfər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə dedi: «Mənə tövsiyə (nəsihət) et!». (Peyğəmbər) buyurdu: «Qəzəblənmə!». (Adam): Sualını bir neçə dəfə təkrar etdi. (Peyğəmbər) yenə: «Qəzəblənmə!» - deyə buyurdu» . Muaz b. Ənəs - *radıyallahu anhu*– rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü Allah hamının gözü qarşısında öz qəzəbinə hakim olan bir kimsəni çağıracaqdır və ona Cənnət hurilərindən istədiyini seçmə imkanını verəcəkdir» . Süleyman b. Surad - *radıyallahu anhu* – rəvayət edir ki, iki nəfər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – yanında bir-birlərini söydülər. Bunlardan birinin (qəzəbinin şiddətindən) gözləri qızarmağa və şah damarları şişməyə başladı. Peyğəmbər: «Mən elə bir kəlimə bilirəm ki, əgər o, kimsə bunu desə qəzəb halı ondan soyuyar. O kəlimə: «***Əuzu Billəhi Minəş Şeytanir Racim*** – lənətlənmiş şeytandan Allaha sığınıram - sözüdür» deyə buyurdu. Bu sözləri eşidən bir nəfər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanından qalxaraq bu sözləri o, qəzəbli adama çatdırdı. O, da: «Sən məni məcnun (dəli) sayırsan» deyə cavab verdi . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizdən hər hansı bir kimsə qəzəblənmiş olarsa ayaqdadırsa otursun. Əgər qəzəbi keçərsə məsələ yox. Əgər keçməzsə uzansın» .

İman sayəsində isə Allah öz mömin bəndəsini qoruyur, onun qəlbini sabit edir və ona hidayət verir. Görürsən ki, mömin insan müsibətlər anında özündən çıxmır, dünya və axirətinə ziyan gətirə biləcək hər hansı bir əməl etmir. Hər bir işdə Allah ona hidayət verir. Ona gizli qalan işdə Allah onunla birlikdə olur. Onu doğruldur və müvəffəq edir. Onun köksünü İslama açır. Həmçinin də onun köksünü xeyirə və özünün razı qaldığı işə açır. Bunun müqabilində görürsən ki, xoşuna gəlmədiyi bir işdə onun qəlbində sıxıntı olur. Bu da Allahın öz bəndəsini dost tutmasıdır. Bu da imanın səmərələrindən və bərəkətindəndir.

## İMANIN MƏRTƏBƏLƏRİ

İman şöbələrdən və hissələrdən ibarətdir. İnsan bu hissələri, şöbələri yerinə yetirərsə imanı da kamilləşər. Əgər tərk edərsə imanı da naqisdəşər. Günahları artdıqca bir o, qədər də imanı naqislik tərfdən artar. Bəzən də o. dərəcəyə çatır ki, onda imandan arpa, buğda qədər iman qalır. Bəzən də elə olur ki, mühüm bir əməli tərk etdiyinə görə onda imandan heç bir şey qalmır. Bu əməli tərk etmək küfrü vacib edir. Çünki imanın əsli və kamilliyi vardır. İmanın əsli qəlbdədir. Bu da başlanğıcdır. Bu başlanğıcda kifayət deyildir. Bu başlanğıc (imanın əsli) insanın dünya və axirətdə əmin olması üçün kifayyət deyildir. Belə bir insan bununla kifayətlənərsə o, əmin ola bilməz. Əgər o, imanı kamilləşdirməsə dünya və axirətdə təhlükələrə, cəzaya məruz qalar. Buna görə ona vacibdir ki, imanın vacib şöbələrini tamamlasın ki, nicat tapanlardan olsun. Əgər iman şöbələrdən, hissələrdən ibarətdirsə onda iman əhli də bərabər deyildir.

Möminlər iman baxımından bir-birindən fərqlənirlər. Bu da imanın nəticəsidir. Onlar fərqlənirlər imanın keyfiyyət və kəmiyyət tərəfdən kamilləşdirməkdə. Görürsən

---

[648] Buxari 6114, Müslim 2606.
[649] Buxari 6116.
[650] Əbu Davud 4777, Tirmizi 2022,2495.
[651] Buxari 3882, Müslim 2610.
[652] əl-Albani «Mişkətul Məsabih» 5114.

ki, bəziləri imanın bu şöbələrinin az bir hissəsini yerinə yetirir. Artıq bu insanda ***Kəmiyyət*** – say tərəfdən imanı zəifdir. Bəziləri isə imanın çox şöbələrini yerinə yetirir, lakin ibadətlərini (xuşu) ilə, elmlə yerinə yetirmir. Bu da ***Keyfiyyət*** - tərəfdən imanını naqisləşdirir.

Möminlər həmçinin də iman elmində, əxlaqında, zahiri və batini əməllərdə də çox fərqlənirlər. Kamil mömində iman elminin elə təfsilatı, elə əməlləri vardır ki, bu kimi şeylər başqa möminlərdə yoxdur. Görürsən ki, çox mömində iman elmi zəif və ümumidir. Kamil mömində isə geniş və təfsilatilədir. Elm o, qədər güclüdür ki, heç bir şəkk-şübhəsi yoxdur. Digərinə isə şübhə salınarsa o, dəqiqə də şübhəyə düşər. Bu da imanı və elmin zəiflyinə görədir. Əgər insanın əməli sağlam olarsa onun qəlbinin sağlam olmasına və qəlbində olan imanın güclü olmasını bildirir. Əgər əməli korlanarsa onun qəlbinin zəif olduğuna və qəlbinin korlandığını bildirir. Buna görə də möminlər həm keyfiyyət, həm də kəmiyyət tərəfdən imanda bir-birlərindən fərqlənirlər.

***İmanın Mərtəbələri***

**1.** ***İmanın Əsli*** **–** Buna «***Mucməl İman***» və ya «***Mutləq İman***» da deyilir. İmanın bu mərtəbəsi əskilməyi qəbul etməz. Çünki bu İslamın sərhədidir. İman ilə küfr arasında ayırd edici bir nöqtədir. Bu cür iman, iman dairəsinə girən hər kəs üçün vacibdir. Şərri hökmlər bununla sabit olur. Çünki iman ismi və hökmü ona dahil olan hər kəsi – onların imanları kamil mərtəbədə olmasa da belə öz içərisinə alır. Böyük günah edən kimsə bu mənanın içərisinə girir. Lakin imanın həqiqətini və vacib olan kamilliyini (mömin vəsfini) ortadan qaldırır. Böyük günah etmək imanın əslini insandan çəkib aparmaz. Lakin ona mütləq olaraq tam bir iman vəsfi də verilməz. Bu mərtəbədə olmaq üçün imanı tam bilmək şərt deyildir. Bu mərtəbənin sahibi İslam dairəsinin və ya sərhədli imanın (muqayyəd imanın) içindədir. Qəlblərində imanın həqiqəti tam olaraq nüfuz etməyən kimsələrdən saleh əməllər edən müsəlmanlar da bu mərtəbədədirlər. Bu mərtəbənin sahibləri nöqsan imanlı mömin, fasiq və ya asi kimi isimlərlə də isimləndirilirlər.

**2.** ***Vacib İman*** **–** Bu mərtəbəyə «***Müfəssəl İman***» və ya «İmanın həqiqəti» mərtəbəsi də deyilir. Bu mərtəbə «İmanın əsli» mərtəbəsindən sonra gəlir. Bu mərtəbədə olan kimsə vacibləri yerinə yetirər, böyük günahlardan və pisliklərdən çəkinir, dinin bütün ayrıntılı hökmlərini təsdiq edir və gücü yetdiyi qədər gizlində də, aşkarda da onlara bağlı qalır. Biliyi və əməli artıqca imanı da artır. Bu mərtəbənin sahibinə əzabsız bir Cənnət vəd edilmişdir. Bu iman üzərə ölərsə Cəhənnəmə girməkdən qurtulur.

**3.** ***Müstəhəb İman*** **–** Bu mərtəbə «Vacib iman» mərtəbəsindən sonra gəlir. Bu ehsan mərtəbəsidir. Bu mərtəbənin sahibləri vacibləri yerinə yetirmək və pisliklərdən çəkinməklə kifayətlənməz. Bunları aşaraq müstəhəb əməlləri edər və Allahın ona verdiyi imkan çərçivəsində məkruhlardan və şübhəli şeylərdən uzaq durar. ***«Sağ tərəf sahibləri. Kimdir onlar? Sol tərəf sahibləri. Kimdir onlar? Və bir də öndə olanlar! Öndə olanlar!».*** *(əl-Vaqiə 8-10).* ***«Sonra Kitabı bəndələrmizdən seçdiklərmizə miras qoyduq. Onlardan kimisi özünə zülüm edər*** *(pis əməlləri yaxşı əməllərindən çox olar)****, kimisi mötədil*** *(pis əməlləri ilə yaxşı əməlləri bərabər)* ***olar, kimisi də Allahın izni ilə yaxşı işlərdə*** *(başqalarını qabaqlayıb)* ***irəli keçər.*** *(yaxşı əməlləri pis əməllərindən çox olar).* ***Bu böyük lütfdür. Onlar Ədn Cənnətlərinə daxil olacaq, orada altun bilərziklər və incilərlə bəzənəcəklər. Libasları da ipəkdən olacaqdır».*** *(Fatir 32-33).*

**1. *Sabiqunlar*** – sabiqunlar özləri də üç yerə bölünürlər. 1) Peyğəmbərlərə yaxın olanlar, 2) Ortada olanlar, 3) Muxtasidlərə yaxın olanlar. Xeyir işlərdə irəli keçənlər fərz və müstəhəbləri edənlər, haram və məkruhları tərk edənlər, şübhəli şeylərdən uzaq olanlar. Bu sanki Allahı görür kimi ibadət edən ehsan mərtəbəsindəki quldur. O, müstəhəb və kamil iman sahibidir. Bunlar mükərrəb olanlardır. Onlar sorğu-sualsız Cənnətə girəcəklər. Çünki onlar artıq vacib əməlləri aşaraq (edib), müstəhəb əməllərə keçmişlər. Onlar müstəhəb imandadırlar. İmanın müstəhəb dərəcəsindədirlər ki, bu da onların vəsfləridir. ***«Onlar gecələr** (ibadətlə məşğul olub) **az yatırdılar. Səhərlər isə** (Allahdan) **bağışlanmalarını diləyirdilər».*** *(əz-Zariyat 17,18).* ***Muhsinun, Muqarrabun, Siddiqun, Sabiqun*** və s. onların gözəl isimləri vardır. Bu ayədə zikr olunanlar isə ***Muhsinlər*** barəsindədir.

**2. *Muxtasidlər*** – Muxtasidlər özləri də üç yerə bölünürlər. 1) Sabiqunlara yaxın olanlar, 2) Ortada olanlar, 3) Zalimunlara yaxın olanlar. Orta yolda olanlar. Bunlar imanın əsaslarını düzgün yerinə yetirənlərdir. Vacibləri yerinə yetirər, haramlardan çəkinərlər və günah etdikləri zaman dərhal tövbəyə tələsənlərdi. Lakin bu qism müstəhəb əməlləri yerinə yetirmir və bəzən də məkruhları edirlər. Lakin onlar günah etdikləri zaman tövbəyə tələsərlər. Bular vacib iman sahibləridir. Muxtasidlərlə zalimunlar arasında fərq – zalimunlar böyük günahlara davam edirlər, muxtasidlər isə dərhal tövbəyə tələsərlər. ***«O, müttəqilər ki, bir günah iş gördükləri, yaxud özlərinə zülm etdikləri zaman Allahı yada salıb günahlarının bağışlanmasını istəyərlər».*** *(Ali İmaran 135).* ***«Ancaq tövbə edib iman gətirən və yaxşı işlər görənlərdən başqa, Allah onların pis əməllərini yaxşı əməllərə çevirər. Allah bağışlayan və rəhm edəndir».*** *(əl-Furqan 70).* Onlar bilə-bilə günah üstündə davam etməzlər. Nəyə görə? Çünki onlarda elm vardır. Bu da ikinci fərqdir. Özlərinə zülm edənlərdə ümumi iman vardır. Lakin təfsilatı ilə deyildir. Onlar imanı xırdalıqla öyrənməyiblər. Amma muxtasidlər isə Allahı tanımaq bilgisində, elə bir bilgi ki, onların dərəcələri qalxır və imanları kamilləşməyə doğru yönəlir. Onların Allahı tanımaqları onların günahlarının bağışlanmasına səbəbdir. Çünki onlar bilirlər ki, Allaha qarşı çıxmaq böyük günahdır və buna görə də şiddətli əzab vardır. Həmçinin də onlar bilirlər ki, Allah tövbə edənləri sevir. ***«Ey***

---

[653] Buna əməl edən savab qazanır. Onu tərk edən isə əzaba düçar olur. Məs: Namaz, oruc və s. əməllər.
[654] Buna əməl edən savab qazanır. Onu tərk edən isə əzaba düçar olmur.
[655] Bunu tərk edən savaba nail olur, əməl edən isə əzaba düçar olmur. Məs: Məscidə sol ayaq ilə daxil olmaq.
[656] Bunu tərk edən savab qazanır. Ona əməl edən isə əzaba düçar olur. Məs: Zina, içki və s. əməllər.
[657] ***Tövbənin Sərtləri.* 1. *Allaha Səmimi Qəlbdən Tövbə Edib Bagışlanma Diləmək: «Tövbə edib Rəbbinizə dönün. Əzab sizə gəlməmişdən əvvəl ona təslim olun. Sonra sizə heç bir kömək olunmaz».*** *(əz-Zumər 54).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Günaha görə tövbə edən o, günahı etməmiş kimidir» İbn Məcə əl-Albani «Səhihul Cəmi» 3008. **2. *Günahlara Görə Peşmançılıq Çəkmək:*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Peşmançılıq – tövbədir» İmam Əhməd, İbn Məcə əl-Albani «Səhihul Cəmi» 6802. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sol kitab sahibi öz qələmini günah etmiş müsəlmandan altı saat müddətinə qaldırar. Əgər o, tövbə edib bağışlanma diləyərsə etdiyi günah yazılmaz. Əksi təqdirdə onu bir günah olaraq qeyd edər» Təbərani «əl-Kəbir», Beyhəqi «Şuab əl-İman» əl-Albani «Səhih Silsilə» 1209. **3. *Günah Etdiyin Yerdən Dərhal Uzaqlaşmaq:*** Əbu Səid Sad b. Məlik b. Sinan əl-Xudri – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Sizdən əvvəlki ümmətlərdə doxsan doqquz insan öldürmüş bir kimsə var idi. Bu kimsə (öldürdükdən) sonra yer üzünün ən alim insanını axtarmağa başlayır. Ona (İsrail oğullarından) bir rahibi göstərirlər. O, rahibin yanına gələrək: «Mən doxsan doqquz insan öldürmüşəm və tövbə etməyin mənə faydası olacaqmı?» deyə soruşdu. Rahib: «Xeyr!» deyə cavab verincə onu da öldürür. Beləcə (öldürdüyü insanların sayını) yüzə çatdırır. Sonra yenə də yer üzünün ən alim insanını axtarmağa başlayır. Ona bir nəfər elmli insanı göstərirlər. Alimin yanına gələrək yüz nəfər öldürdüyünü və tövbə etməyin ona fayda verəcəyi haqqında soruşur. Alim: «Bəli! Tövbə edən insana kim mane ola bilər! Sən filan yerə get! Çünkü orada Allaha ibadət edən bir tayfa vardır. Onlarla birlikdə Allaha ibadət et və bir daha bu məmləkətə qayıtma. Çünkü bura çox pis yerdir! Bu (söhbətdən) sonra adam alimin dediyi yerə yollanır. Lakin yolun yarsına çatdıqda ölüm onu yaxalayır. Bu kimsəyə görə Rəhmət mələkləri ilə əzab mələkləri bir-biriləri ilə mübahisəyə başlayırlar. Rəhmət mələkləri: «Bu adam tövbə edərək və qəlbini Allaha yönəldərək gəldi!» deyirlər. Əzab mələkləri:

***möminlər! Hamılıqla Allaha tövbə edin ki, bəlkə nicat tapasınız».*** *(ən-Nur 31).* ***«Ey iman gətirənlər! Allaha səmimi qəlbdən tövbə edin».*** *(ət-Təhrim ).* ***«Tövbə etməyənlər zalimlərdir».*** *(əl-Hucurat 11).* Onlar əməllərini sünnə üzərində qururlar, bidətlərdən uzaqdırlar və buna görə də bu mərtəbə Muxtasidlər mərtəbəsi adlanır.

**3.** ***Zalimunlar*** – Zalimunlar özləri də üç yerə bölünürlər. 1) Muxtasidlərə yaxın olanlar, 2) Ortada olanlar, 3) Küfrə yaxın olanlar. Bunlarda imanın əsli vardır. Lakin nəfslərinə zülm edərlər. Bəzi haramları (böyük günahları) etməklə bərabər, imanlarını qorumaqla bərabər, bəzi fərzləri yerinə yetirməkdə də qüsurlara yol verərlər. İcmali

---

«Bu adam bu günə qədər heç bir xeyir işləməmişdir!» deyirlər. Bu an insan qiyafəsində bir mələk onların yanına gəlir və hər iki tərəf onu öz aralarında hakim təyin edirlər. O, deyir: «Gəldiyi yer ilə gedəcəyi yeri ölçün! Hansı tərəf daha yaxın olarsa ora aiddir!» Mələklər hər iki tərəfi ölçürlər və adamın getdiyi yerə yaxın olduğunu görürlər və Rəhmət mələkləri onun ruhunu alıb gedirlər (aparırlar)». Başqa rəvayətdə: «Uca Allah günahkarların yaşadığı yerə uzaqlaş! Tövbə edib getdiyi yerə yaxınlaş!» deyə vəhy etdi. Və mələklərə: «Hər iki tərəfin məsafəsini ölçün!» deyə buyurdu. Mələklər də hər iki tərəfi ölçdülər. Tövbəkarın gedəcəyi yerə bir qarış yaxın olduğunu gördülər. Bundan ötrü də (Allah) onun günahlarını bağışladı» Buxari, Müslim. **4.** ***Günaha Bir Daha Qayıtmamaq:*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Bütün Adəm övladı xəta edəndir. Xəta edənlərin ən xeyirlisi Allaha tövbə edənlərdir» Tirmizi, İbn Məcə. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Ey insanlar! Allaha tövbə edin. Mən gündə **70** (bir rəvayətdə: **100**) dəfə Allahdan bağışlanma diləyirəm» Buxari, Müslim. Əli – *radıyallahu anhu* – deyir ki: «Bəla ancaq günahla nazil olur və töbvə ilə silinir». **5.** ***Tövbəni Əcəl Gəlməmişdən Qabaq Etmək: «Günah işləri görməyi davam etdirib yalnız ölüm yatağında mən indi tövbə etdim deyəndən və kafir kimiölənin tövbəsi qəbul olunmaz».*** *(ən-Nisa 17,18).* Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Allah qulunun tövbəsini gün batdığı yerdən çıxanadək qəbul edir» Müslim. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Allah qulunun tövbəsini ruh boğazdan çıxanadək qəbul edir» Əhməd, Tirmizi, əl-Albani «Səhihul Cəmi» 6132, Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qəlbim əlində olan Allaha and olsun ki, əgər siz günah etməsəniz Allah sizi məhv edər və sizin yerinizə elə bir tayfa gətirər ki, onlar günah edər sonra da Allahdan bağışlanma diləyərlər. Allah da onları bağıışlayar»[657] ***«Ey iman gətirənlər! Sizdən hər kəs dinindən dönsə Allah onun yerinə elə bir tayfa gətirər ki, Allah onları, onlar da Allahı sevərlər. Onlar möminlərə qarşı mülayim, kafirlərə qarşı sərt olarlar. Allah yolunda vuruşar və heç kəsin tənəsindən qorxmazlar. Bu Allahın lütfüdür onu istədiyinə verər».*** *(əl-Maidə 54).* **6.** ***Qulun Haqqını Vermək:*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Kim öz qardaşının haqlarını tapdalayıbsa qoy onun haqqını Qiyamət günü gəlməmişdən qabaq ödəsin. O, gün ki nə dinar, nə də dirhəm kömək edə biləcəkdir. Qiyamət günü haqları tapdalayanın savablarından alınaraq zülm etdiyi insanlara verilir. Əgər zülm etdiyi qulların haqlarını ödəmədən əvvəl savabları qurtararsa zülm etdiyi qulların günahlarından alınaraq ona yüklənər və sonra da Cəhənnəmə atılar» Buxari, Müslim 2581. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bilirsinizmi Müflis kimdir?». Səhabələr: «Bizim nəznimizdə müflis kimsə heç bir pulu və ruzisi olmayan bir kimsədir» dedilər. Peyğəmbər: «Mənim ümmətimdə Müflis kimsə Qiyamət günü namazı, orucu, zəkatı ilə gələcəkdir. Lakin onu söymüş, buna iftira atmış, birinin malını yemiş, qanını tökmüş və döymüşdür. Savablarından alınaraq zülm etdiyi insanlara verilir. Əgər zülm etdiyi qulların haqlarını ödəmədən əvvəl savabları qurtararsa zülm etdiyi qulların günahlarından alınraq ona yüklənər və sonra da Cəhənnəmə atılar» Müslim 2581. Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in ətrafında oturmuşduq. Birdən o, gülməyə başladı. Ömər – *radıyallahu anhu* –: «Atam, anam sənə fəda olsun! Nə üçün güldün?» deyə soruşdu. Peyğəmbər: «Ümmətimdən iki insan Allahın hüzurunda diz çökmüşdülər. Onlardan biri: «Ya Rəbbim! Bu qardaşım mənə haqsızlıq etmişdir. Ondan haqqımı al!» deyər. Allah: «Qardaşının haqqını ödə» deyə buyurar. O: «Ya Rəbbim! Ona verəcək həsənatlərim artıq qalmadı» deyər. Allah: «Onun həsənatləri artıq qalmayıb» deyə buyurar. Adam: «Ya Rəbbim! Günahlarımı ona yüklə!» deyər. Bu sözlərdən sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ağladı. Qiyamət günü çox böyük bir gündür. O, gün insanlar günahlarının bir qismini başqalarına yükləmək ehtiyacını duyacaqlar. Sonra sözünə davam edərək Allah: «Başını qaldır Cənnətə bax!» deyə buyurar. Adam başını qaldırıb Cənnətə baxdıqda: «Ya Rəbbim! İnci ilə taclanmış, gümüşdən şəhərlər, qızıldan köşklər görürəm. Bunlar hansı Peyğəmbərin, siddiqin, şəhidindir» deyər. Allah: «Bunlar haqları ödəyənlərindir» deyə buyurar. Adam: «Ya Rəbbim! Buna kim sahib ola bilər» deyər. Allah: «Sən, sahib ola bilərsən» deyə buyurar. Adam: «Nə ilə?» deyər. Allah: «Qardaşını bağışlamaqla» deyə buyurar. Adam: «Ya Rəbbim! Mən onu bağışladım» deyər. Allah Qiyamət günü möminlərin arasını düzəltməklə onları barışdıracaqdır. Beyhəqi, Əbu Yala. AbdurRahman b. Cubeyr, o da Əbu Tufeyldən rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına ixtiyar yaşına çatmış bir kişi gəlir (Başqa rəvayətdə: Qaşları gözünün üstünü örtmüş, əsasına söykənərək Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanında dayanaraq) deyir: «Sən yer üzündə belə bir insan görmüsənmi ki, böyüklü, kiçikli heç bir günahdan yan keçməyərək onları edib (Başqa rəvayətdə: Əgər onun günahlarını yer əhli arasında paylasaydılar hamını həlak edərdi). Mənim üçün tövbə varmı?». Peyğəmbər: «Sən İslamı qəbul etmisənmi?» deyə buyurdu. O: «O, ki qaldı mənə – Şəhadət edirəm ki, Allahdan başqa ibadətə layiq heç bir ilah yoxdur və sən Allahın Rəsulusan» dedi. Peyğəmbər: «Yaxşı işlər gör və pis işləri də tərk et, Allah da sənin bütün əməllərini xeyirli edər» deyə buyurdu. O: «Oldu! Allahu Əkbər! – deyərək gözdən itənə qədər getdi» Təbərani, əl-Bəzzar «Məcmə Zəvaid» 1/36, İbn Həcər «əl-İsabə» 4/149.

iman sahibləri. Onlar imtahana çəkiləndə bəziləri ayılaraq elm əhlinə yaxınlaşır və bununla da nicat tapırlar. İmtahandan salamat çıxaraq Muxtasidlər dərəcəsinə yaxınlaşırlar. ***«De ki: «Allah başınızın üstündən və ayaqlarınızın altından sizə əzab göndərməyə, sizi dəstələr halında qarışdırmağa və birinizə digərinizin zorunu daddırmağa qadirdir! Gör ayələrimizi onlara nə cür izah edirik ki, bəlkə başa düşsünlər!».*** *(əl-Ənam 65).* Baxmayaraq ki, onlar müsəlmandırlar, onlarda iman vardır, onların ***Lə İləhə İlləllahı*** vardır, Tövhidi vardır bununla yanaşı onları dünyada da, axirətdə də təhlükələr gözləyir. Allah onların etdiyi günahlar üçün müvafiq cəzalar hazırlamışdır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə yuxusunda göstərilən qəbr əzabı[658], böyük günah sahibləri üçün (içki içən, zinakar, oğru, təkəbbürlü, özünü öldürən, nəmmamlıq, çəkidə aldatmaq, yetimin malını yemək, haram yemək və haram ilə məşğul olmaq, sələmçilik, qumar, ismətli qadınlara böhtan atmaq, insan öldürmək və s.) günalarına görə onlar üçün qorxu, narahatçılıq, əzab vardır. Qəlbləri yerindən qopardan bir qorxu. Bəziləri bu günahlardan qəbrdə təmizlənəcəklər. Qəbr əzabı vasitəsilə qiyamət günü gəldikləri zaman onlar artıq günahlarından təmizlənmiş halda olacaqlar. Bunlardan təmizləndiklərinə görə tərəziyə qoyulcaq bir şey olmayacaqdır. Çünki qoyulacaq günahları qalmamışdır. Lakin bunlar sağ tərəf sahiblərindən aşağıdırlar.

Onların cəzası bununla da qurtarmayacaqdır. Onlar üçün Qiyamət günü xüsusi tərtib vardır. Nə üçün? Çünkü onlar Allahın haram buyurduğlarına qarşı cürətlənmiş, Allaha asi olmuşlar. Baxmayaraq ki, onlar Allahı tanıyırdılar, Allahı təkləşdirirdilər. Lakin onlar bu Tövhidi, bu iqrarı qorumadılar. Allah ilə insan arasında olan əhdi, sözü ***– Lə İləhə İlləllah –*** kəliməsini qorumadılar. Əksinə bu kəliməyə xələl gətirdilər. Qiyamət günü onlar həşr olunacaq yerə toplanılacaqlar. Günəş onlara yaxınlaşdırılacaqdır. Günahlarının çoxluğuna görə tər içərisində olacaqlar. Sonra onları susuzluq bürüyəcəkdir. Onlara deyəcəklər ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in hövuzuna gəlmirsinizmi? Onlara hövuzun sahəsinə girməyə maneçilik törədiləcəkdir. Sonra onlara su ilə dolu kasalar uzadılacaqdır. Bu sudan Muxtasidlər, Səbiqunlar içicəklər və bir daha əbədiyyən susamayacaqlar. Orada olan özlərinə zülm edənlər, bidət əhli, böyük günah sahibləri bu şiddətli istidə əllərini o, kasalara uzadacaqlar. Onlar ilə kasa arasında az bir məsafə qalmışkən kasa onlardan uzaqlaşdırılacaqdır və onlara mane olacaqlar. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizdən hovuza ilk gələn mən olacağam. Mənim yanıma gələcək olan oradan içəcək, oradan bir dəfə içən əbədiyyən susamayacaqdır. Mənim yanıma mənim tanıdıqlarım, onların da məni tanıdıqları bir qism insanlar gələcəklər. Mənimlə onların arasında əngəl qoyulacaqdır». Başqa rəvayətdə: «Onlar məndəndirlər» deyəcəyəm. Mənə: «Sən onların səndən sonra nələr uydurub ortaya çıxartığını bilmirsən». Bu dəfə mən də: «Məndən sonra dəyişiliklər ortaya çıxaranlar məndən uzaq olsunlar, məndən uzaq olsunlar»[659] Onların yaxşı əməlləri ilə pis əməlləri tərəziyə qoyulacaqdır. Bunlar da üç qismə bölünür. 1) Zalimunlar içərisin də yaxşı əməlləri ilə pis əməllərindən üstün olanlarda vardır. Bunların axırı Cənnətə daxil olmaqdır. 2) Yaxşı əməlləri ilə pis əməlləri bərabər olanlardır. Onlar Cənnətlə, Cəhənnəm arasında bir yerdə duracaqlar. Bu yerin adı ***Əraf*** - adlanır. Bu onlar üçün əzabdır. Necə ki, onlar dünyada ikən küfr və iman arasında idilər. Onlar Cənnəti gördükləri zaman tamahları artar, Cəhənnəmi

---

[658] Bu haqda kitabımızın «Qəbr əzabı» bölümündə danışmışıq.
[659] Buxari.

gördükləri zaman isə onların qəlbləri qorxudan yerindən qopar. Onların orada qalmaqları Allahın istəyi qədər olacaqdır. Bundan sonra onlar Sırata yönəldiləcəklər. Onların orada yerişi yaxşı əməlləri pis əməllərindən üstün olanların yerişindən aşağı olacaqdır. 3) Pis əməlləri yaxşı əməllərindən üstün olanlar. Bunlar Cəhənnəmə girməyə layiqdirlər (istisna şəfaətdir).

Bütün bunlardan sonra Sırat kətiriləcəkdir. Sabiqunlar onun üzərindən ildırım sürəti ilə keçəcəklər. Həmçinin Muxtasidlərdə küləyin sürəti kimi onun üzərindən keçəcəklər. Bunlardan sonra zalimunlar gətiriləcəklər. Onlar da dərəcələrinə görə kimisi sürünə-sürünə, kimisi də iməkləyərək onun üzərindən keçəcəklər. Bunlar da pis əməlləri yaxşı əməllərindən çox olanlardır. Cəhənnəmin istisi onlara toxunacaqdır və onları Cəhənnəmdən çıxan qırmaqlar yaxalayacaqlar. Onların o, körpünün üzərindən keçmələri uzun müddət davam edəcəkdir. Bu da onların etdikləri günahların müqabilindədir. Abdullah b. Abbas – *radıyallahu anhu* – dedi ki: «Xeyirdə yarışan hesaba çəkilmədən Cənnətə girəcəkdir. Ortada gedənlər Allahın rəhmətiylə Cənnətə girəcəklər. Özlərinə zülm edənlər Muhəmmədin şəfaəti ilə Cənnətə girəcəklər .

## İMANIN FAYDALARI VƏ SƏMƏRƏLƏRİ

İman neməti bir müsəlmanın həyatında çox böyük və uca bir nemətdir. Müsəlmanın ömrünü arındırır, həyatını bərəkətləndirir, axirəti zəmanət edər, sahibini dünya və axirətdə ucaldar. Çünki onda həqiqi bir həyat və axirət səadəti vardır. Bu neməti ancaq dadan bilir. Onu ancaq yaşayan hiss edər. Səhih və səmimi bir imanın həm dünya həyatın da, həm də axirət həyatın da faydaları və səmərələri vardır.

1. İman sahibləri Allahın dostluğunu qazanan bəxtiyar insanlardır. ***«Allah, Ona iman edənlərin dostudur. Onları zülmətdən çıxarıb işığa tərəf yönəldər. Kafirlərin dostu isə şeytandır. Onları nurdan ayırıb zülmətə salarlar. Onlar Cəhənnəmlikdirlər və orada əbədi qalacaqlar».*** *(əl-Bəqərə 257).*

2. İman sahibləri gözəl bir həyatın sevincini yaşayırlar. ***«Mömin olub yaxşı işlər görən*** *(Allaha itaət edən)* ***kişi və qadına (****dünya və axirətdə)* ***xoş həyat nəsib edəcəyik və etdikləri yaxşı əməllərə görə mükafatlarını verəcəyik».*** *(ən-Nəhl 97).*

3. İman sahiblərini Allah da sevər, möminlər də. ***«Həqiqətən iman gətirib yaxşı işlər görənlər üçün Allah*** *(ürəklərində)* ***bir sevgi yaradacaqdır».*** *(Məryəm 96).*

4. İman sahiblərini Allah qoruyur. ***«Şübhəsiz ki, Allah iman gətirən kəsləi*** *(kafirlərin əzab-əziyyətindən)* ***qorur. Allah həqiqətən heç bir xaini və nankoru sevməz».*** *(əl-Həcc 38).* ***«Möminlərə kömək etmək Bizə vacibdir».*** *(ər-Rum 47).* ***«Allah heç vaxt kafirlərə möminlərin əleyhinə olan bir yol göstərməz».*** *(ən-Nisa 141).*

5. İman sahibləri üçün dünya və axirətdə müjdələr vardır. ***«Bilin ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər. O, kəslər ki, iman gətirmiş və pis əməllərdən çəkinmişlər. Onlara dünyada da, axirətdə də müjdə vardır. Allahın sözləri heç vaxt dəyişməz. Bu ən böyük qurtuluş və uğurdur».*** *(Yunus 62-64).*

6. İman sahiblərinin bəla və müsibətlər qarşısında ən böyük təsəlliləri imandır. ***«Kim Allaha iman gətirərsə Allah onun qəlbini haqqa yönəldər və o, dünyada baş verən hər şeyin Allahın əzəli hökmü və izni ilə olduğunu bilər. Allah hər şeyi biləndir».*** *(ət-Təğabun 11).*

---

[660] İbn Teymiyyə «əl-Əqidətul Vasitiyyə», Təfsiri Təbəri 11/ s. 189, Təfsir İbn Kəsr.

7. İman sahibləri əmin-amanlıqdadırlar. ***«Allahın sizə*** *(ibadət edilməsi barədə)* ***heç bir dəlil endirmədiyi bütləri Ona şərik qoşmaqdan qorxmadığınız halda mən niyə sizin şərik qoşduqlarınızdan qorxmalıyam? Əgər bilirsinizsə*** *(deyin görək)* ***bu iki dəstədən hansı*** *(qiyamət əzabından)* ***əmin olmağa daha haqlıdır? İman gətirib imanlarını zülmlə qarışdırmayanlar əmin-amanlıqdadırlar. Haqq yola yönəlmişlər də onlardır»*** *(əl-Ənam 81,82).*

8. Allah iman sahibləri ilə bərabərdir. ***«Həqiqətən Allah möminlərlədir!».*** *(əl-Ənfal 19).* ***«Həqiqətən Allah Ondan qorxub pis əməllərdən çəkinənlər və yaxşı işlər görənlərlədir».*** *(ən-Nəhl 128).*

9. İman sahibləri üstün və dəyərlidirlər. ***«Halbuki şərəf-şan da, qüvvət və qələbə də yalnız Allaha Onun peyğəmbərinə və möminlərə məxsusdur, lakin münafiqlər*** *(bunu)* ***bilməzlər».*** *(əl-Munafiqun 8).* ***«Ruhdan düşməyin və qəmgin olmayın. Halbuki əgər möminsinizsə siz çox yüksəkdə durursunuz».*** *(Ali-İmran 139).*

10. İman sahiblərinin imanları onları çirkin və iyrənc şeylərə düşməkdən qoruyar. ***«Doğurdan da qadın ona meyl salmışdı. Əgər Rəbbinin dəlilini görməsəydi, Yusif də ona meyl edərdi. Biz pisliyi və biabırçılığı ondan sovuşdurmaq üçün belə etdik. O. həqiqətən bizim sadiq bəndələrmizdəndir».*** *(Yusif 24).*

11. İman sahibləri haqq ilə batili, hidayət ilə sapığlığı və sünnət ilə bidəti imanlarının nuru ilə ayrıd edirlər. İman parlayan və aydınlatan bir nurdur. Möminin qəlbində doğar, sonra onun əzalarını və yolunu işıqlandırar. Sonra altından çaylar axan və bitməz tükənməz nemətləri olan əbədi Cənnətə onu götürəcək yolu işıqlandırar. ***«Ey iman gətirənlər! Allahdan qorxun və Onun Peyğəmbərinə iman gətirin ki, Allah sizə öz mərhəmətindən iki pay versin, sizə*** *(sıratın)* ***üstündən getməyiniz üçün nur bəxş etsin və sizi bağışlasın. Allah bağışlayan, rəhm edəndir».*** *(əl-Hədid 28).*

12. Allah iman sahiblərinə imanı sevdirir və onların qəlblərində imanı süsləmişdir. Sahibi onsuz gözəl görsənməz. İmanın ziddini də onlara çirkin göstərmişdir. Bu zinəti Allah qullarından dilədiyinə bəxş edər, onu qat-qat artırar və bunu onların qəlblərinə buraxar. ***«Lakin Allah imanı sizə sevdirmiş, onu qəlblərinizdə süsləmiş, küfrə itaətdən çıxmağa və*** *(Allah)* ***asi olmağa qarşı sizdə nifrət oyatmışdır. Məhz belələri doğru yolda olanlardır».*** *(əl-Hucurat 7).*

13. İman gözəl, bərəkətli, dəyərli, xeyirli, faydalı, meyvəli, canlı, köklü, sağlam və böyüyən bir ağaca bənzər. Bu ağacın gövdəsi yerdə sabit və kökləri yerin dərinliklərinə qədər ulaşır. Möminin qəlbindəki iman da belədir. Qəlbin dərinliklərinə kök salar. Bol meyvələr verər. ***«Məgər Allahın necə məsəl çəkdiyini görmürsənmi? Xoş bir söz*** *(Lə İləhə İlləllah, Muhəmmədən Rəsulullah)* ***kökü yerdə möhkəm olub budaqları səmaya ucalan gözəl bir ağac*** *(xurma ağacı)* ***kimidir. O, ağac Rəbbinin izni ilə hər vaxt bəhrəsini verir. Allah insanlar üçün belə məsəllər çəkir ki, bəlkə bəlkə düşünüb ibrət alsınlar!*** *(Ağacı kökü yerdə, budaqları göydə olduğu kimi möminin də imanı qəlbində sabit qalır, əməlləri isə göyə – Allahın dərgahına yüksəlib ona daim savab qazandırır).* ***Pis söz isə yerdən qopardılmış, kökü olmayan pis bir ağaca bənzəyir».*** *(İbrahim 24).*

14. İmanın möminin qəlbində yerləşməsi mənəvi bir durumdur. Lakin iman möminin qəlbində yerləşdikdə hiss edilən, maddi bir şeyə dönər, artıq mömin onu hiss edər, görər və qəlb onun içün iman evi halına gələr. ***«Mühacirlərdən əvvəl*** *(Mədinədə)* ***yurd salmış və iman gətirmiş kimsələr*** *(ənsar)* ***öz yanlarına*** *(şəhərlərinə)* ***mühacirət edənləri sevər, onlara verilən qənimətə görə ürəklərində həsəd, qəzəb duymaz, özləri ehtiyac içində olsalar belə, onları özlərindən üstün tutarlar.*** *(Allah tərəfindən)*

***nəfsinin xəsisliyindən, tamahından qorunub saxlanılan kimsələr – məhz onlar nicat tapıb səadətə qovuşanlardır».*** *(əl-Həşr 9).*

15. İman sahiblərinə Allah dünyada əmin-amanlıq, xoşbəxtlik, axirətdə isə əbədi qalacaqları Cənnət, gözlərin görmədiyi, qulaqların duymadığı nemətləri vəd etmişdir. ***«İman gətirib yaxşı işlər görənləri Rəbbi iman gətirdiklərinə görə hidayətə*** *(Cənnətə)* ***qovuşdurar.*** *(Bol nemətli)* ***Naim Cənnətlərində onların*** *(köşkləri)* ***altından çaylar axar».*** *(Yunus 9).* ***«Yalnız mömin kişilərə və qadınlara altından çaylar axan Cənnətlər və Ədn cənnətlərində gözəl məskənlər vəd buyurmuşdur. Onlar orada əbədi qalacaqlaq. Allahdan olan bir razılıq isə daha böyükdür. Bu ən böyük qurtuluş və uğurdur!».*** *(ət-Tövbə 72).*

# ALLAHA İMAN

Allaha iman onun varlığına iman etmək deməkdir. Bu da Fitrət, Ağıl, Şəriət və Duyğularla olur.

**1.** ***Fitrət:*** Fitrətin Allahın varlığına dəlalət etməsi: Şübhəsiz hər bir yaradılış yaradıcısına iman etmək fitrətinə sahib olaraq yaradılmışdır. ***«(Ya Muhəmməd!) batildən haqqa tapınaraq üzünü Allahın fitri olaraq insanlara verdiyi dinə*** *(İslama)* ***tərəf tut».*** *(ər-Rum 30).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Rəbbindən buyurduğu rəvayətdə: «Mən qullarımı həniflər[661] olaraq yaratdım. Lakin sonradan şeytanlar onları dinlərindən sağa-sola sürüklədilər. Onlara halal etdiyimi qadağan etdilər və haqqında heç bir dəlil nazil etmədiyim şeyləri Mənə şərik qoşmağı əmr etdilər»[662]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurur: «Hər bir doğulan uşağ fitrət üzərində doğular. Lakin sonra valideyinləri onu Yəhudi, Xristian və ya Məcusi edər»[663].

**2.** ***Ağil:*** Ağlın Allahın varlığına dəlalət etməsi: Əvvəlinci ilə sonuncuya qədər bütün yaradılmışların var edici bir yaradıcısı olması qaçınılmaz bir şeydir. Çünki bu yaradılmışların özü-özlərini var etmələri imkansız olduğu kimi, təsadüfən var olmalarına da imkan yoxdur. Özü-özlərini var etmələri imkansızdır. Çünki heç bir şey özü-özünü yaratmaz. Çünki o, şey var olmadan əvvəl yox idi. Yox olmaq heç bir şey olmaq deməkdir. Heç bir şey isə bir şeyi var edə bilməz. Necə özü-özünün yaradıcısı, var edəni ola bilər? Bu yaradılmışlar təsadüfən də var ola bilməz. Çünki sonradan meydana gələn hər bir şeyin mütləq bir meydana gətirəni vardır.

O, özündən əvvəl heç bir şeyin olmadığı ***Əvvəl***, ondan sonra heç bir şeyin qalmayacağı ***Axır***, ondan üstə heç bir şeyin olmadığı ***Zahir***, ondan o, tərəfə heç bir şeyin olmadığı ***Batindir***. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – yatağına girdikdə buyurardı: «Yeddi səmanın Rəbbi, yerin Rəbbi, hər şeyin Rəbbi, toxumu və çərdəyi yaran, Tövratı, İncili və Quranı endirən Allahım! Mən sənin alnından yaxaladığın hər şeyin şərrindən sənə sığınıram. Sən ***Əvvəlsən***, səndən əvvəl heç bir şey yoxdur. Sən ***Axırsan***, səndən sonra heç bir şey yoxdur. Sən ***Zahirsən***, sənin üstündə heç bir şey yoxdur. Sən ***Batinsən***,

---

[661] ***Hənif*** – haqq üzərində düz yeriyən və ona uyan kimsə deməkdir. Bütün dinlərdən üz çevirərək haqqa yönələn kimsədir. «Lisanul–Ərabiyyə» 9/157, «İbn Kəsir təfsir» 1/186-187, «Muhtarus–Sihah» s. 159. Digər bir tərif : Şirkdən uzaq olan, Allaha ixlas üzərində bina edilmiş dinin adıdır. «Uç əsas» Seyx Useymin – *rahmətullahi aleyhi* – nin şərhi ilə.

[662] Buxari, Müslim.

[663] Buxari, Müslim 2658.

səndən o, tərəfə heç bir şey yoxdur. Mənim borcumu ödə və faqirlikdən məni qurtar» . O, hər şeyə həyat verən özü də mütləq şəkildə həyat sahibi olan ***Həyy***, bütün varlılıqların işini düzüb qoşan, öz yoluna qoyan ***Qayyum***, bir və tək olan ***Əhəd***, heç kimə möhtac olmayan ***Saməd***, aləmlərin Rəbbi olan Allahdır. ***«Sizi palçıqdan yaradan, sonra da bir əcəl müəyyən edən odur».*** *(əl-Ənam 2).* ***«Sizi yaratdıq, sonra sizə surət verdik….».*** *(əl-Əraf 11).* ***«Biz insanı quru və qoxumuş qara palçıqdan yaratdıq».*** *(əl-Hicr 26).* ***«Sizi torpaqdan yaratması, sonra da sizin bir insan olub yer üzünə yayılmağınız onun qüdrət əlamətlərindəndir».*** *(ər-Rum 20).* ***«O, yaratdığı hər şeyi gözəl yaratdı. İnsanı yaratmağa palçıqdan başladı. Sonra onun nəslini bir qətrə zəif dəyərsiz sudan əmələ gətirdi».*** *(əs-Səcdə 7-8).* ***«Biz həqiqətən insanı tər-təmiz palçıqdan yaratdıq. Sonra onu nütfə halında möhkəm bir yerdə yerləşdirdik. Sonra nütfəni laxtalanmış qana çevirdik, sonra laxtalanmış qanı bir parça ət etdik, sonra o, bir parça əti sümüklərə döndərdik, sonra sümükləri ətlə örtdük və daha sonra onu yeni bir məxluq olaraq yaratdıq. Yaradanların ən gözəli olan Allah nə qədər ulu və ucadır».*** *(əl-Muminun 12-14).* ***«O, insanı laxtalanmış qandan yaratdı».*** *(əl-Ələq 2).* ***«O, axıb tökülən bir sudan yaranmışdır. O, su*** *(kişilərin)* ***bel sümüyündən,*** *(qadınların)* ***köks sümüyündən çıxar».*** *(ət-Tariq 6-7).* ***«Halbuki, sizi də sizin düzəltdiklərinizi də Allah yaratmışdır».*** *(əs-Saffət 96).*

Allah Qurani Kərimdə ət-Tur surəsində buyurur: ***«Yoxsa onlar heç bir şeydən*** *(xaliqsiz)* ***yaradılıblar? Yaxud onlar*** *(öz-özlərini)* ***yaradanlardır?».*** *(ət-Tur 35).* Bu ayə nazil olduğu zaman Cubeyr b. Mutim Rəsulullah – *sallallahu aleyhi və səlləm* - in bu ayəni oxuduğunu dinləmiş və demişdir: «Mən müşrik idim. Bu ayəni eşitdikdə qəlbim az qala yerindən çıxacaqdı. Bu an imanın qəlbimə girdiyi ilk an idi» . Bütün bu ayə və hədislər heç bir şeyin təsadüfən var olmasına ehtimal buraxmır.

**3. *Şəriət:*** Şəriətin Allahın varlığına dəlalət etməsi: Bütün səmavi kitablar Allahı tanımaq, onun göndərmiş olduğu şəriəti qəbul etmək və əmrlərinə gərəkli şəkildə itaət etmək, boyun əymək və bu kitablarda olan xəbərlərin hər şeyi var etməyə qadir olan Allah tərəfindən endirilmiş olduğuna dəlildir. Qul Allahın kitabında olan ayələr haqqında düşündükcə Rəbbini bilib tanıyır. Qul bu ayələr haqqında nə qədər düşünsə onun biliyi, elmi o, qədər də artar. ***«Yerdə tam yəqinliklə insanlar üçün əlamətlər vardır. Sizin özünüzdə də əlamətlər vardır».*** *(əz-Zariyat 20-21).* ***«Göylərdə və yerdə neçə-neçə əlamətlər nişanələr vardır ki, insanlar onların yanından üzlərini çevirib keçirlər».*** *(Yusif 105).*

**4. *Duyğular:*** Duyğuların Allahın varlığına dəlalət etməsinə gəlincə bu iki yolladır.

**1)** Bizlər dua edənlərin, dualarının qəbul edilməsi, sıxıntı anlarında əllərini göyə qaldıraraq dua etmələri qəlbdən olan o, hisslər, duyğular Allahın varlığına dəlalət edir. ***«O, zaman siz*** *(dua edərək)* ***Rəbbinizdən kömək diləyirdiniz».*** *(əl-Ənfal 9).*

Həmçinin Ənəs b. Məlik – *radıyallahu anhu* – rəvayət edir ki, bir gün bir Bədəvi ərəb cümə günü Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – xütbə verərkən məscidə girib deyir: «Ey Allahın Rəsulu! Mallarımız tələf oldu, uşaqlarımız ac qaldı. Bizim üçün Allaha dua et». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – əllərini qaldıraraq dua etdi. Buludlar dağlar kimi ortaya yığıldılar. Minbərdən enməmiş yağış dənələri saqqalından süzülməyə başladı. İkinci cümə yenə o, bədəvi ərəb qalxıb dedi: «Ey Allahın Rəsulu! Evlərimiz dağıldı, mallarımızı sular yuyub apardı. Bizim üçün Allaha

---

[664] Müslim, Əbu Davud, Tirmizi.
[665] Buxari.

dua et» Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – əllərini qaldıraraq dua etdi: «Allahım üztümüzə, ətrafımıza yox!» Əli ilə işarə etdiyi tərəfə yağış yağmağa başladı» . Allaha səmimi olaraq sığınan və duasının qəbul edilmə şərtlərini yerinə yetirən hər bir kəsin dualarının qəbul edilməsinin günümüzdə də şahidi oluruq.

**2)** ***Möcüzə*** **–** insanların gördükləri və ya Peyğəmbər olaraq göndərənin varlığına kəsin bir dəlildir. Onları göndərən isə Allahdır. Çünki bunlar bəşəriyyətin güc və taqətindən kənar olan xüsuslardır. Allah möcüzələri Peyğəmbərlərini dəstəkləmək və onlara kömək etmək üçün meydana gətirir. Məs: Musa – *əleyhissəlam* – ın əsası. Allah ona: «Əsanı dənizə vur!» deyərək əmr etdikdə o, da əsanı dənizə vurdu. Dəniz on iki ayrı yola ayrıldı. Bu yollar arasında sular dağları xatırladırdı. ***Onda Musaya belə vəhy etdik: «Əsanla dənizə vur. Dərhal yarıldı və hər hissə böyük bir dağ kimi oldu».*** *(əş-Şuəra 63).* İsa – *əleyhissəlam* – hansı ki, Allahın izni ilə ölüləri dirildirdi. ***«Sizin üçün palçıqdan quşa bənzər bir surət düzəldib ona üfürərəm, o da Allahın izni ilə quş olar. Anadan gəlmə korları, cüzəm xəstəliyinə tutulanları sağaldar və Allahın izni ilə ölüləri dirildirəm».*** *(Ali-İmran 49).* Muhəmməd – *sallallahu aleyhi və səlləm* – hansı ki, Qureyş ondan bir möcüzə göstərməsini istəmiş o, da aya işarə edərək ayı iki yerə ayırmışdı. ***«Qiyamət yaxınlaşdı, ay*** *(Peyğəmbərin möcüzəsi ilə)* ***parçalandı».****(əl-Qəmər 1).*

Allah yaratdıqlarını yox edər, ancaq özü əbədi qalar. Ancaq onun istədiyi olur. O, istədiyini edəndir. ***«Allah öz istədiyini edər!»*** *(əl-Bəqərə 253).* Allah bir işi istədiyi zaman bütün yaratdıqları onu istəməsələr də onu yaradır. Əgər Allah istəməzsə yaratdıqlarından hamsı bir olsalar da onu istəyə bilməzlər. Bu şeydə olan xeyir və şər onun istəməsi ilə olur. O, nəyi istəmişsə o, da olur, nəyi istəməmişsə o, da olmaz. Allahın yaratdıqlarından heç birisi öz elmi ilə onu qavraya bilməz. Zənlər, düşüncələr, təsəvvürlər onu başa düşə bilməz. ***«Onların elmi isə onu əhatə edib qavraya bilməz».*** *(Ta ha 110).* Yaratdıqlarından heç kimsə onun zatının sirlərini bilməz. O, da yaratdıqlarından heç birinə nə zatında, nə isimlərində, nə də sifətlərində, nə də əməllərində bənzəməz. Onun misli yoxdur. ***«Əgər Rəbbinin sözlərini yazmaq üçün dəryalar mürəkkəb olsaydı və bir o, qədər ona əlavə olunsaydı yenə də Rəbbinin sözləri tükənməzdən əvvəl onlar tükənərdi».*** *(ən-Kəhf 109).* ***«Əgər yerdə hər bir ağac qələm olsaydı və dəryalar mürəkkəb olsaydı və yeddi dərya belə ona qoşulsaydı yenə də Rəbbinin sözləri tükənməzdi. Həqiqətən Allah yenilməz qüvvət və hikmət sahibidir».*** *(Loğman 27).* O, ölməzdir, daima diridir (*Həyydir*). Ölüm ona gəlməz. ***«Ölməz, həmişə diri olan Allaha bel bağla».*** *(əl-Furqan 58).* O, nə mürgülər, nə də onu yuxu tutar (*Qayyumdur*). Yoxsa kainatda hər şey məhv olardı. Allah insanlara, cinlərə, quşlara, vəhşi heyvanlara, möminlərə, kafirlərə və istəyənə istədiyini verdiyi zaman mülkündən heç bir şey əskilməz. Əbu Zərr əl-Ğifari - *radıyallahu anhu* – dan, o da Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən, (Peyğəmbərdə) Uca və böyük olan Rəbbindən buyurmuşdu: «Ey mənim qullarım, sizlərdən birincilər və axırıncılar, insanlar və cinlər bir yerdə toplansalar və hamısı birlikdə məndən istəsələr, mən onların hər birinin istədiyini verərəm. Bu mənim yanımdakı şeylərdən iynənin dənizə salındığı (və çıxarıldığı) zaman əskiltdiyi qədər əskildər» . O, yaratdıqlarını qorxuya düşmədən öldürür, çətinlik görmədən yenidən yaradır.

---

[666] Buxari.
[667] Müslim.

# ALLAHA İMANIN FAYDALARI

Allaha iman etmək möminlərə olduqca xeyirli və dəyərli faydalar verər:

**1.** Allahı başqalarından bir şey ümüd etməyəcək, başqalarından qorxmayacaq və başqasına ibadət etməyəcək şəkildə, həqiqi mənada Tövhid etmək.

**2.** Allahı kamil dərəcədə sevməyə çalışmaq, onun İsim və Sifətlərinə lazımı şəkildə təzim etmək.

**3.** Əmr etdiklərini yerinə yetirmək, qadağalarından çəkinməklə ona ibadət etmək.

# MƏLƏKLƏRƏ İMAN

Mələklərə iman hər hansı bir şübhə və tərəddütdən uzaq olaraq var olduqlarına inanmaq deməkdir. ***«Peyğəmbər Rəbbi tərəfindən ona nazil edilənə*** *(Qurana)* ***inanmış və möminlər də iman gətirmişlər.*** *(onların)* ***Hamısı Allaha, onun mələklərinə, kitablarına və bütün peyğəmbərlərinə iman gətirmişlər…».*** *(əl-Bəqərə 285).*

Mələklər aləmi bir qeyb aləmidir. Allah tərəfindən yaradılmış və Allaha ibadət edən varlılıqlardır. Allah onları nurdan yaratmış, əmrlərinə tam uymağı və əmrlərini yerinə yetirmək gücünü vermişdir. Aişə – *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah mələkləri nurdan, cinləri tüstüsüz oddan, Adəmi isə sizə deyildiyi şeydən (yaratdı)»[668]. ***«Möhtərəm qullardır. Onlar Allahdan qabaq söz danışmazlar və yalnız onun əmri ilə iş görərlər».*** *(əl-Ənbiya 26-27).* ***«Onlar Allaha ibadət etməkdə təkəbbürlük göstərməz və bunda yorulmazlar. Onlar gecə-gündüz yorulmaq bilmədən Rəbbini təqdis edib şəninə tariflər deyirlər».*** *(əl-Ənbiya 19-20).*

***Mələk – Ələkə - Malaka – Malak -*** sözündən götürülüb, göndərilən mesaj, məktub deməkdir. Cəmi – ***Mələikə -*** deməkdir. Bəziləri deyirlər ki: ***Mələk – Mulk –*** sözündən törənmişdir. Mələklərin varlılıqlarını inkar edən hər hansı bir şəxs kafir olur. ***«Allaha, onun mələklərinə, kitablarına, peyğəmbərlərinə və axirət gününə inanmayan şəxs, şübhəsiz ki,*** *(doğru yoldan)* ***çox azmışdı».*** *(ən-Nisa 136).* Bu baxımdan da Əhli Sünnə vəl Cəmaat icma ilə mələklərə inanırlar.

Mələklərin nə vaxt yaradıldıqları barədə məlumat yoxdur. Lakin onların insandan qabaq yaradılmış olduqları bilinməkdədir. ***Sənin Rəbbin mələklərə: «Mən yer üzündə bir xəlifə yaradacağam» dedikdə, mələklər: «Biz sənə şükür etdiyimiz, şəninə tariflər dediyimiz və səni müqəddəs tutduğumuz halda sən yer üzündə fəsad törədəcək və qan tökəcək bir kəsmi yaratmaq istəyirsən?» söylədilər. Allah*** *(onlara):* ***«Mən bildiyim şeyi siz bilmirsiniz!».*** *(əl-Bəqərə 30).*

İnsanın Mələkdən əfsəl və İblisdən üstün olması. ***«Biz mələklərə Adəmə səcdə edin!» dedik.*** *«(əl-Bəqərə 34).* ***«Pervərdigara! Bir de görək nə üçün onu məndən üstün tutdun».*** *(əl-İsra 62).*

Mələklərin sayı çoxdur. Sayını Allahdan başqa heç kimsə bilməz. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Meraca gedərkən ona səmadakı Beytul-Məmur göstərilmiş və orada hər gün yetmiş min mələyin ibadət edib, oradan çıxdıqdan sonra bir daha ora qayıtmamaqları bildirilmişdi[669]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – səhabələrə buyurur: «Səmada olan səsləri eşidirsinizmi?» Səhabələr: «Biz heç ə

---

[668] Müslim 2996.

[669] Buxari 3207, Müslim 429.

eşitmirik?» dedilər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həqiqətən də Mən səmanın qıcırdamasını eşidirəm. Qıcırdama ona xas olan bir şey deyildir. Göydə elə bir qarış yer yoxdur ki, orada Qiyamda və Səcdədə olan mələk olmasın»[670].

Mələklərə iman özündə bir neçə xüsusiyyətləri birləşdirir ki, bunları da hər bir müsəlmanın bilib iman gətirməsi vacibdir.

**1.** Onların varlılıqlarına iman gətirmək.

**2.** Cəbrail, Mikail, İsrafil – *əleyhimussəlam* - kimi adlarını bildiyimiz mələklərə iman, adlarını bilmədiyimiz mələklərə isə icma ilə iman gətirmək.

**3.** Cəbrail – *əleyhissəlam* – kimi sifətlərini bildiyimiz mələklərin o, sifətlərinə iman gətirmək. Məs: Allah bizim onları görməyimizi əngəlləşdirmişdi. Buna görə də biz onları yaradılmış şəkildə görə bilmərik. Lakin bəzi qullara onları görmək icazəsi verilmişdi. ***«Biz öz ruhumuzu Məryəmin yanına göndərdik. O, Məryəmə kamil bir insan qiyafəsində göründü».*** *(Məryəm 17).*

***Həmçinin*** - İbrahim və Lut – *əleyhimussəlam* - ın yanına insan qiyafəsində gəlmişlər. ***«Həqiqətən elçilərimiz*** *(mələklər)* ***İbrahimin yanına müjdə ilə gəlib salam verdilər».*** *(Hud 68).* ***«Elçilərimiz*** *(mələklər)* ***Lutun yanına gəldikləri zaman…».*** *(Hud 77).*

***Həmçinin -*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Cəbrail – *əleyhissəlam* – ı öz qiyafəsində görmüşdü. ***«O, qüvvət sahibi göründü. O*** *(Cəbrail)* ***ən uca üfüqdə idi». «And olsun ki, başqa bir dəfə də görmüşdü.*** *(yeddinci səmadakı)* ***Sidrətulmuntəhanın yanında».*** *(ən-Nəcm 6-14).* Cəbrail – *əleyhissəlam* – ın insan qiyafəsində saçları olduqca qara, düm ağ paltarda Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına, onların dinlərini onlara öyrətməyə gəlmişdi[671]. Cəbrail – *əleyhissəlam* – əksər vaxtlarda gözəl səhabə olan Dihyə b. Xəlifətil əl-Kəlbi – *radıyallahu anhu* – nun qiyafəsində gələrdi[672].

***Həmçinin -*** Mələklərin çox qanadlı olmaları. ***«Göyləri və yerləri yoxdan yaradan, iki qanadlı, üç qanadlı, dörd qanadlı mələkləri elçi edən Allaha həmd olsun».*** *(Fatir 1).*

***Həmçinin -*** Mələklər Allahın ordularıdır. ***«Rəbbinin ordularını özündən başqası bilməz. Bu insanlar üçün ancaq bir öyüd-nəsihətdir».*** *(əl-Muddəssir 31).*

***Həmçinin -*** Allahın izni ilə insanları qoruyurlar. ***«İnsan üçün onu öndən və arxadan təqib edən mələklər vardır. Onlar insanı Allahın əmri ilə qoruyurlar».*** *(ər-Rəd 11).* Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Əbu Cəhl: «Muhəmməd sizin aranızda üzünü torpağa sürtürmü?» Ona: «Bəli, sürtür» - dedilər. O, dedi: «Lat və Uzzaya and olsun ki, əgər onun belə etdiyini görsəm boynundan tutub torpağa sürtəcəyəm». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – namaz qılmağa başladığı vaxt Əbu Cəhl gəldi və onun boynunu basmaq istədi. Bu vaxt sanki əlləri ilə özünü qoruyaraq geri çəkildi. Ona: «Sənə nə oldu?» deyə soruşduqda o dedi: «Mənimlə onun arasında içi odla dolu xəndək var idi və mənim ona yaxınlaşmağıma mane olurdu». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Əgər o, mənə yaxınlaşmış olsaydı mələklər onu parça-parça edərdilər»[673].

---

[670] əl-Albani "Səhih Hədislər Silsiləsi" 852.
[671] Müslim 8.
[672] İmam Əhməd, İbn Sad "Təbaqat".
[673] Müslim 2797.

***Həmçinin*** **-** Mələklər Allaha yaxınlaşdırılmış varlılıqlardır. Kişi və qadın vəsfləri yoxdur. ***«Onlar Rəhmanın qulları olan mələkləri dişi saydılar. Məgər onlar mələklərin yaradılışına şahidmi olmuşlar. Onları bu şəhadəti yazılacaq və sorğu-sual olunacaq».*** *(əz-Zuxruf 19).* ***«Kafirlər Rahmən övlad götürdü dedilər. O, pak və müqəddəsdir. Xeyr mələklər möhtərəm qullardır».*** *(əl-Ənbiya 26).*

***Həmçinin*** **-** Yeməzlər, içməzlər. ***«Həqiqətən elçilərimiz*** *(mələklər)* ***İbrahimin yanına müjdə ilə gəlib salam verdilər. İbrahim də: «Salam!» deyə cavab verdi və dərhal*** *(gedib onlara)* ***qızardılmış bir buzov gətirdi. İbrahim*** *(qonaqların)* ***əllərini yeməyə uzatmadıqlarını gördükdə onların bu hərəkəti xoşuna gəlmədi və qorxuya düşdü».*** *(Hud 69-70).*

***Həmçinin*** **-** Onların qidaları Allahı zikr etməkdir. Bundan da əsla usanmaz və buna ara verməzlər, yorulmazlar. ***«Onlar Allaha ibadət etməkdə təkəbbürlük göstərməz və bunda yorulmazlar. Onlar gecə-gündüz yorulmaq bilmədən Rəbbini təqdis edib şəninə təriflər deyirlər».*** *(əl-Ənbiya 19-20).* ***«Rəbbinin yanında olanlar ona ibadət etməyi özlərinə ar bilməzlər. Onu pak, müqəddəs tutub şəninə təriflər deyər və ancaq ona səcdəyə qapanarlar».*** *(əl-Əraf 206).*

***Həmçinin*** **-** Həya və utanmaq kimi sifətlərə sahibdilər. Aişə – *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ayaqları baldıra (və ya diz qapaqlarına) qədər açıq vəziyyətdə uzanmışdı. Əbu Bəkr, Ömər – *radıyallahu anhum* – onun yanına içəri girdikdə o, ayaqlarının üstünü örtmədi. Lakin Osman – *radıyallahu anhu* – onun yanına girən kimi ayaqlarının üstünü örtdü. Niyə belə etdiyini soruşduqda: «Mələklərin həya etdiyi bir kəsdən mən necə həya etməyim»[674].

***Həmçinin*** **-** Allaha itaət və ona üsyan etməmək fitrəti ilə yaradılıblar. ***«Xidmətçiləri isə Allahın onlara verdiyi əmrlərə asi olmayan, buyurduqlarını yerinə yetirən daş qəlbli*** *(heç kəsə zərrəcə rəhm etməyən)* ***və çox sərt təbiətli mələklərdir».*** *(ət-Təhrim 6).*

**4.** Mələkləri Allahın əmrlərini yernə yetirdiklərinə və hər birinin müəyyən vəzifəsi olduğuna iman gətirməliyik.

Cəbrail – *əleyhissəlam* – Allahın vəhyinin əminidir. Allah vəhy ilə onu Rəsullara və Peyğəmbərlərə göndərir. Mikail – *əleyhissəlam* – yağış və bitkilərlə, İsrafil – *əleyhissəlam* – Qiyamətin qopacağı və insanların diriləcəgi vaxt sura üfürəcək, Ölüm mələyi ölüm anında ruhları almaqla əmr olunur. ***De ki: «Sizə müvəkkil olan ölüm mələyi canınızı alacaqdır».*** *(əs-Səcdə 11).* O, yaradılmış olaraq mələklərin ən əzəmətlisidir. Onun haqqında Quran və Sünnədə bəlli bir ad yoxdur. Bəziləri Əzrail deyə adlandırırlar. Lakin bu haqda heç bir yerdə məlumat yoxdur.

***Həmçinin*** **-** kimilərinə Ərşi daşımaq: ***«Həmin gün sənin Rəbbinin ərşini onların başı üstündə səkkiz mələk daşıyacaqdır».*** *(əl-Həqq 17).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah mənə Ərşi daşıyan mələklərin biri haqqında danışmağa icazə vermişdi. Onun qulağının ucu ilə çiyni arasındakı məsafə yeddi yüz (Quş uçuşu) ilə bərabərdir»[675].

***Həmçinin*** **-** Kimisinə Cəhənnəmin atəşini qorumaq Məlik və Cəhənnəmin mələkləri Zəbanilər: ***«Onlar müraciət edib deyəcəklər: Ey Məlik! Qoy Rəbbin bizi öldürsün*** *(bu əzabdan qurtaraq).* ***O, isə*** *(min ildən sonra onlara)* ***Siz*** *(həmişəlik burada)* ***qalacaqsınız».*** *(əz-Zumər 77).* ***«Biz də Zəbaniləri*** *(Cəhənnəmdəki əzab mələklərini)* ***çağıracağıq».*** *(əl-Ələq 18).*

---

[674] Müslim 2401.

[675] Əbu Davud 4729. əl-Albani "Səhih".

***Həmçinin*** - Kimiləri möminlərin ruhlarını rahatlıqla alırlar: ***«And olsun*** *(möminlərin canını)* ***rahatlıqla alanlara».*** *(ən-Nəziat 2).* ***Şübhəsiz ki: «Rəbbimiz Allahdır!» deyən, sonra da düz olan kəslərə*** *(ölüm ayağında)* ***mələklər nazil olub belə deyəcəklər: «Qorxmayın və kədərlənməyin! Sizə vəd olunan Cənnətlə sevinin!».*** *(Fussilət 30).*

***Həmçinin*** - Kimiləri kafirlərin ruhlarını zorla alırlar: ***And olsun*** *(kafirlərin canını)* ***zorla alanlara».*** *(ən-Nəziat 1).* ***«Kaş ki, sən zalimləri ölüm əzabı içində çapalayan, mələklərin də əllərini uzadıb: «Çıxarın canlarınızı! Siz bu gün Allaha qarşı nahaq sözlər danışdığınıza və onun ayələrinə təkəbbürlük göstərdiyinizə görə alçaldıcı bir əzabla cəzalandırılacaqsınız» dediyini görəydin.*** *(əl-Ənam 93).*

***Həmçinin*** - Kimiləri insanın ana bətnində olduğu müddətdə qədərini yazmaq ilə: Əbu AbdurRahmən Abdulla b. Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, doğru sözlü və doğru sözü təsdiq olunan Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Sizdən hər birinizin yaradılışı onun anasının qarnında qırx gün nütfə[676] şəklində olaraq bir yerə gətrilir. Sonra bu müddət ərzində aləqa[677] şəklində olur. Sonra yenə bu müddət ərzində mudğa[678] şəklində olur. Sonra ona bir mələk göndərilir, hansı ki, ona ruh üflədikdən sonra dörd xüsusiyəti yazmaqla əmr olunur. Ruzisini, əcəlini, əməlini, bədbəxt və ya xoşbəxt olacağını»[679].

***Həmçinin*** - Onlardan möminlərə məğfirət diləyən, onlara dua edən, möminləri sevən kimsələr olduğu kimi elm məclislərinə gələrək onları əhatəyə alan, onların etdiklərini Allaha çatdıran, elm öyrənən və öyrədən üçün dua edən mələklər də var. ***«Həqiqətən Allah və mələkləri Peyğəmbərə salavat göndərirlər…».*** *(əl-Əhzab 56).* Əbu Umәmə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Həqiqətən Allah, mələkləri, göydə və yerdə olanlar, qarışqa öz yuvasında hətta balıqlarda elm öyrədənə dua edirlər»[680]. Əbu Dərda - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Hər kim elm öyrənmək üçün müəyyən bir yola çıxarsa Allah onun Cənnətə gedən yolunu asanlaşdırar. Mələklər elm tələbəsinin bu əməlindən xoş olduqları üçün qanadlarını onun üzərinə açarlar. Göylərdə və yerdə olan hər bir şey onun üçün bağışlanma diləyər»[681]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər kim elm öyrənmək üçün müəyyən bir yola çıxarsa Allah onun Cənnətə gedən yolunu asantlaşdırar. Bir topluluq Allahın evlərindən birində toplanıb, Allahın kitabını oxuyar və öz aralarında onu müzakirə edərlərsə onlara Allah tərəfindən sakitlik enər, Allahın rəhməti onları örtər, mələklər onları əhatəyə alarlar, Allah onları öz dərgahında olanların yanında yad edər. Hər kim bu əməlləri gecikdirərsə, nəticəsi onu irəli hərəkət etməyə qoymaz (geri düşər)»[682].

***Həmçinin*** - Mələklərin möminlərin dostları və onları sevmələri. ***Şübhəsiz ki: «Rəbbimiz Allahdır!» deyən, sonra da düz olan kəslərə*** *(ölüm ayağında)* ***mələklər nazil olub belə deyəcəklər: «Qorxmayın və kədərlənməyin! Sizə vəd olunan Cənnətlə sevinin! Biz dünyada və axirətdə də sizin dostlarınızıq. Orada*** *(Cənnətdə)* ***sizin üçün***

---

[676] ***Nütfə*** – məni mənasındadır. Nütfə bəzən də saf su adlanır.
[677] ***Aləqa*** – laxtalanmış qan, ziyil deməkdir. ***O, insanı laxtalanmış qandan yaratdı.*** *(əl-Ələq 2).*
[678] ***Mudğa*** – çeynənilmiş ət parçasına oxşadığı üçün ona bu ad verilmişdir.
[679] Buxari 3208, Müslim 2643.
[680] Səhih Sünən Tirmizi 2161, 2686.
[681] Əbu Davud 3641, Səhih Sünən Tirmizi 2159, 2683.
[682] Müslim 2699.

***nəfslərinizin çəkdiyi, istədiyiniz hər şey vardır».*** *(Fussilət 30-31).* Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Əgər Allah bir qulu sevərsə əmr edir Cəbrailə: «Şübhəsiz Allah filan qulu sevər, sən də onu sev!» deyə nida edər. Cəbrail də onu sevər. Sonra Cəbrail da səmadakıları səsləyərək: «Şübhəsiz Allah filan qulu sevir, siz də onu sevin!». Səmadakılar da onu sevərlər. Sonra da onun sözü yer üzündə məqbul (qəbul) sayılar»[683].

***Həmçinin*** - Mələklərin kafirləri, müşrikləri, münafiqləri sevməmə-ləri və onlara nifrət etmələri. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Əgər Allah bir qulu sevməzsə əmr edir Cəbrailə: «Şübhəsiz Allah filan qulu sevmir, sən də onu sevmə!» deyə nida edər. Cəbrail də onu sevməz. Sonra Cəbrail da səmadakıları səsləyərək: «Şübhəsiz Allah filan qulu sevmir, siz də onu sevməyin!». Səmadakılar da onu sevməzlər. Sonra da yer üzündə olan insanların qəlbində (Allah tərəfindən) o, kimsə haqqında nifrət və kin qoyular»[684].

***Həmçinin*** - Mələklər birinci səfdə olanlar, namazı gözləyənlər üçün dua edirlər. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Namazın girmə vaxtını gözləyən insanlar üçün mələklər Allaha dua edərək, Ya Rəbbimiz onu bağışla, ona rəhm et»[685]. Bəra b. Azib - *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həqiqətən Allah və mələkləri birinci səff üçün dua edərlər»[686]. Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şübhəsiz Allah və Mələkləri səflərin sağında olanlara rəhmət və istiğfar diləyərlər»[687].

***Həmçinin*** - Mələklərin Cümə günü insanları qeyd etmələri. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər– *sallallahu aleyhi və səlləm* – buyurdu: «Cümə günü oldu mu məscidin hər bir qapısı üzərində mələklər durub sıra ilə tez gələnləri qeyd edərlər. İmam xütbə vermək üçün oturdumu onlar da səhifələri bağlayıb xütbəni dinləməyə gedərlər»[688].

***Həmçinin*** - Mələklərin xəstəni ziyarət edən üçün dua etmələri. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir kəs öz müsəlman qardaşını səhər ziyarət etməyə getsə axşamadək yetmiş min mələk onun üçün bağışlanma diləyər, axşam getsə səhərədək yetmiş min mələk onun üçün bağışlanma diliyər»[689].

***Həmçinin*** - Kiramə və Kətibin mələkləri. Allah onları üzərimizə əməllərimizi, sözlərimizi və davranışımızı yazmaq üçün mükəlləf edib. Bizi ancaq ayaq yoluna girdiyimiz və cima halında tək buraxarlar. ***«Sizin üstünüzdə gözətçi mələklər*** *(əməllərinizi)* ***yazan və*** *(Allah dərgahında)* ***çox hörmətli mələklər vardır. Onlar sizin nə etdiklərinizi bilirlər».*** *(əl-İnfitar 10-12).* ***«Şübhəsiz ki, elçilərimiz qurduğunuz hiylələri*** *(əməl dəftərinizə)* ***yazırlar».*** *(Yunus 21).* ***«Yoxsa onlar elə güman edirlər ki, biz onların pıçıltılarını və xəlvəti danışıqlarını eşitmirik! Xeyr, yanlarında olan elçilərimiz yazırlar».*** *(əz-Zuxruf 80).* ***«İnsan üçün onu öndən və arxadan təqib edən mələklər vardır. Onlar insanı Allahın əmri ilə qoruyurlar».*** *(ər-Rəd 11).* Peyğəmbər –

---

[683] Buxari 3209, Müslim 2637.
[684] Buxari, Müslim.
[685] Buxari, Müslim 649.
[686] Səhih Sünən Əbu Davud 618, 664.
[687] Əbu Davud 676.
[688] Buxari, Müslim, əl-Albani "Mişkət" 1384.
[689] Səhih Tirmizi 1/286, Səhih İbn Məcə 1/244.

*sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizinlə birlikdə ayaq yoluna girdiyiniz vaxt ilə cima halından başqa sizdən ayrılmayan mələklər vardır. Onlardan həya edin və onlara ikramınız olsun»[690].

***Həmçinin*** - Mələklərin möminlər üçün bağışlanma diləmələri. ***«Ərşi daşıyanlar və onun ətrafında olanlar*** *(mələklər)* ***öz Rəbbini həmd-səna ilə təqdis edir, ona inanır və möminlərin baığışlanmasını diləyərək belə deyirlər: «Ey Rəbbimiz! Sənin rəhmin və elmin hər şeyi ehtiva etmişdir. Artıq tövbə edib sənin yolunla gedənləri bağışla, onları cəhənnəm əzabından qoru».*** *(əl-Mumin 7).* ***«Mələklər də*** *(ondan)* ***bağışlanmağınızı dilərlər. Allah möminlərə rəhm edəndir».*** *(əl-Əhzab 43).*

***Həmçinin*** - Mələklərin möminləri salamlamaları. ***«Rəbbindən qorxanlar dəstə-dəstə gətiriləcəklər. Nəhayət ora çatınca onun qapıları açılacaq və Cənnət gözətçiləri*** *(onlara)* ***Salam aleykum!*** *(Sizə salam olsun)* ***xoş gəldiniz. Əbədi qalacağınız Cənnətə daxil olun».*** *(əz-Zumər 73).*

***Həmçinin*** - Mələklərin sədəqə verənlər üçün dua etmələri. Peyğəmbər– *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər səhər Allahın izni ilə yer üzünə iki mələk enir və Allaha dua edərək deyirlər: «Ey Rəbbimiz! Allah yolunda xərcləyənin ruzisini artır, xəsislik edənin ruzisini isə azalt»[691].

***Həmçinin*** - Mələklərin İbrahim – *əleyhissəlam* – ı oğlu İshaqın olması ilə[692], Məryəmı İsa – *əleyhissəlam* – ın olması ilə[693], Xədicə - *radıyallahu anhə* – ni Cənnətdə onun üçün hazırlanmış daş-qaşlı saray və Allahın salamı ilə[694], Aişə - *radıyallahu anhə* – ni Cəbrail – *əleyhissəlam* – ın salamı ilə müjdələmişlər[695].

***Həmçinin*** - Mələklər Məsih Dəccəlin Məkkə və Mədinəyə girməsinin qarşısını alacaqlar[696]. Qiyamətə yaxın vaxtlarda İsa – *əleyhissəlam* – ın Şamın şərq tərəfində ağ minarəli (məscidin) üstünə iki mələyin qanadında enməsi[697].

***Həmçinin*** - Mələklərin döyüşlərdə müsəlmanlara kömək etməsi, xüsusi ilə Bədr döyüşündə. ***«Rəbbinizin üç min mələk endirərək imdadınıza yetişməsi sizə kifayət etməzmi. Bəli əgər səbr edib*** *(Allahdan)* ***qorxsanız, onlar*** *(Məkkə müşrikləri)* ***qəzəblə üstünüzə gəldikləri zaman Rəbbiniz artıq beş min nişan qoyulmuş mələklə sizə yardım edər».*** *(Ali-İmran 124-125). (əl-Ənfal 9).* Rifa b. Rafi əz-Zurani - *radıyallahu anhu* – rəvayət edir ki, Cəbrail – *əleyhissəlam* – Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Siz Bədr döyüşündə iştirak edənləri nə sayırsınız». (Peyğəmbər) buyurdu: «Müsəlmanların ən xeyirliləri». Cəbrail – *əleyhissəlam* – dedi: «Mələklərdən də Bədr mələkləri belədir»[698].

Əhli Sünnə Vəl Cəmaat qəbr əzabının olduğuna da inanırlar. Qəbr əzabı deyildikdə, bildiyimiz qəbr çuxurunda görülən əzab deyildir. Bərzəx adı verilən aləmdə verilən əzabdır. Əzabı qəbirdə də olsa, yerin dibində də olsa, dəniz dibində də və ya balığın qarnında da olsa bərzəxda əzab görəcəkdir. Munkər və Nəkir mələkləridir ki, bərzəx aləmində insana: «Rəbbin kim? Dinin nə? Peyğəmbərin kim?» - deyə sullar verirlər[699].

---

690 Tirmizi 2800.
691 Buxari 1442, Müslim 1010.
692 Bax: (Hud 71-72).
693 Bax: (Məryəm 19).
694 Bax: Buxari, Müslim 232.
695 Bax: Buxari, Müslim.
696 Bax: Buxari 7125, Müslim 2942.
697 Bax: Müslim.
698 Buxari.
699 əl-Albani «Əhkəmul Cənaiz» s 202, İbn Kəsir 2/131, İbn Həcər 3/234,240.

***Həmçinin*** - Mələklər heykəl, surət və it olan heç bir evə girməzlər. Əbu Təlhə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mələklər it və şəkil olan evə girməzlər»[700].

***Həmçinin*** - Adəm oğullarına əziyət verən şey onlara da əziyyət verir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Soğan və sarmısağ yeyən hər bir kəs bizim məscidə yaxın durmasın. Adəm oğullarına əziyyət verən şey mələklərə də əziyyət verir»[701].

Bütün bunlara iman gətirmək vacibdir. Buna görə də mələklərə iman etmək, imanın əsaslarını təşkil edən altı əsasdan biridir.

# KİTABLARA İMAN

***Kutub*** - Kitablar ləfzindən toplamaq və bir-birinə qatmaq mənasında gələn ***Kətbdən*** gəlməkdədir. Kitabların cəmi, yazılmış deməkdir. Kitablardan qəsd səmadan Allahın Rəsullarına endirilmiş kitablardır. Bizim bu kitablardan bildiklərimiz İbrahim – *əleyhissəlam* – ın səhifələri, Musa – *əleyhissəlam* – a lövhələrdə endirmiş olduğu Tövrat, İsa – *əleyhissəlam* – a endirilmiş olan İncil, Davud – *əleyhissəlam* – a endirilmiş olan Zəbur və son olaraq nazil olan əvvəlkiləri doğrulayan Qurani Kərimdir.

Bizlər Allahın bunlardan başqa Peyğəmbərlərinə endirmiş olduğu başqa kitabların olduğuna da iman edirik. Bunların ad və saylarını Allahdan başqa heç kəs bilməz. ***«Ey möminlər! Allaha və Peyğəmbərinə, onun öz Peyğəmbərinə endirdiyi kitaba*** *(Qurana)* ***və ondan əvvəl nazil etdiyi kitablara iman gətirin!».*** *(ən-Nisa 136).*

Bizlər Allahın Peyğəmbərlərinə endirmiş olan kitabların Allah tərəfindən gəldiyinə, onların haqq olduqlarına, bir hidayət, bir nur, bir bəyan və bir şəfa olduqlarına iman edirik. *(Ey möminlər!)* ***Belə deyin: «Biz Allaha, bizə nazil olan Qurana, İbrahimə, İsmailə, İshaqa, Yəquba və onun övladına göndərilənlərə, Musaya və İsaya verilənlərə, Rəbbi tərəfindən bütün Peyğəmbərlərə verilən şeylərə iman etdik. Onların heç birini digərindən ayırmırıq. Biz ancaq Allaha boyun əyən müsəlmanıq».*** *(əl-Bəqərə 136).* ***«Biz Nuha və ondan sonrakı Peyğəmbərlərə vəhy göndərdiyimiz kimi, sənə də vəhy göndərdik. Biz İbrahimə, İsmailə, İshaqa, Yəquba və onun övladlarına, İsaya, Əyyuba, Yunusa, Haruna və Süleymana da vəhy göndərdik. Biz Davuda da Zəburu verdik».*** *(ən-Nisa 163).* ***«İbarahimin və Musanın səhifələrində».*** *(əl-Əla 19).* ***«Bundan əvvəl insanları doğru yola yönəltmək üçün Tövratı və İncili də*** *(səmadan)* ***o, endirdi.*** *(Haqqı nahaqdan ayırd edən)* ***Furqanı*** *(Quranı)* ***da o nazil etdi».*** *(Ali İmran 3-4).*

Allah kitabları Rəsullarına insanları hidayətə yönəltmək, onları zülmətdən nura çıxartmaq üçün endirmiş olduğuna iman gətirməliyik. ***«Əlif, Ləm, Ra! Bu Quran elə bir kitabdır ki, onu sənə insanları öz Rəbbinin izni ilə zülmətdən nura, həm də yenilməz qüvvət sahibi və hər cür tərifə, şükrə layiq olan Allahın yoluna*** *(İslam dininə)* ***çıxartmaq üçün nazil etmişik».*** *(İbrahim 1).*

Bu kitablardan bəziləri Allahdan, arada elçi, mələk olmadan pərdə arxasından endirilmiş, kimisini də mələk olan elçi, insan olan elçiyə təbliğ etmiş, kimisini də Allah öz əli ilə yazmışdı. ***«Allah onlarla ancaq vəhylə, yaxud*** *(Musa ilə)* ***pərdə arxasından danışar və ya bir elçi*** *(mələk)* ***göndərər, o da Allahın izni ilə Allahın istədiyini vəhy***

[700] Buxari, Müslim.
[701] Buxari, Müslim.

***edər».*** *(əş-Şura 51).* ***«Allah Musa ilə sözlə*** *(arada heç bir vasitə olmadan)* ***danışdı».*** *(ən-Nisa 164).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sənin üçün lövhələrdə hər şeyi çəkdi və sənin üçün Tövratı öz əli ilə yazdı»[702].

Qurana iman etməyə gəlincə, bu da onu iqrar və qəbul etmək, içindəki hökmlərə tabe olmaqdır. Qurandan başqa Allah digər kitabları qorumaq üçün insanların öhdəliyinə buraxmışdı. Lakin onlar bu kitabları qoruya bilmədilər. Onlara haqqıyla riayət etmədilər, kitablarda bir çox dəyişikliklər və yeniliklər etdilər. ***«Halbuki*** *(Musa dövründə)* ***olanların içərsində elələri vardır ki, Allahın kəlamını*** *(Tövratı)* ***dinləyib anladıqdan sonra, onu bilə-bilə təhrif edirdilər».*** *(əl-Bəqərə 75).*

Buna görə də bütün kitablar Qurani Kərimin endirilməsi ilə nəsx[703] edilmiş oldular. Digər tərəfdən əvvəlki kitabların qorunması insanlara həvalə edilmişdisə, Qurani Kərimin qorunmasını isə Allah öz üzərinə götürmüşdür. Bu kitab nə nəsx edilir, nə də dəyişdirilir. Allah dünyadan qaldırdığı günə qədər onu hər cür dəyişikliklərdən, batildən qoruyur. ***«Şübhəsiz ki, Quranı biz nazil etdik və sözsüz ki, biz də onu*** *(hər cür təhrif, artırıb-əskiltmədən)* ***qoruyub saxlayacağıq».*** *(əl-Hicr 9).* ***«Nə öncə, nə də sonra batil ona yol tapa bilməz. O, hikmət sahibi və şükrə tərifə layiq Allah tərəfindən endirilmişdi».*** *(Fussilət 42).* ***«Onlar Quran barəsində düşünməzlərmi? Əgər o, Allahdan qeyrisi tərəfindən olsaydı, əlbəttə onda çoxlu ziddiyyət tapardılar».*** *(ən-Nisa 82).* ***«Yoxsa onu*** *(Peyğəmbər)* ***özündən uydurdu! – deyirlər. Əgər doğru deyirsinizsə ona*** *(Qurana)* ***bənzər bir surə gətirin…».*** *(Yunus 38).* ***«De ki: «Əgər insanlar və Cinlər bir yerə yığışıb bu Qurana bənzər bir şey gətirmək üçün bir-birinə kömək etsələr, yenə də ona bənzərini gətirə bilməzlər».*** *(əl-İsra 88).* ***«Yoxsa müşriklər: «Quranı özündən uydurdu!» – deyirlər. Onlara de ki: «Əgər doğru deyirsinizsə onun kimi özünüzdən on surə uydurub gətirin və*** *(bu işdə)* ***Allahdan başqa kimi bacarırsınızsa köməyə çağırın».*** *(Hud 13).* ***«Əgər doğru deyirlərsə qoy onlar Quran kimi bir kəlam gətirsinlər».*** *(ət-Tur 34).*

Bu baxımdan da hər bir kəs Qurani Kərimin hökmlərinə tabe olmalı, boyun əyməli və ona iman etməlidir. Çünki bu kitab özündən əvvəlki kitabları doğrulayan, onlarda olan dəyişiklikləri və təhrifləri bəyan edən bir kitabdır. ***«Biz sənə Quranı haqq olaraq, özündən əvvəlki kitabı*** *(bütün ilahi kitabları)* ***təsdiq edən və onu qoruyan*** *(və ya onların doğruluğuna şahid)* ***kimi endirdik.*** *(əl-Maidə 48).* ***«And olsun ki, Biz Quranı ibrət almaq üçün belə asanlaşdırdıq. Amma heç bir ibrət alan varmı!».*** *(Qəmər 40).* ***«Quran uydurma bir söz deyildir. Ancaq özündən əvvəlki*** *(ilahi kitabların)* ***təsdiqi****, (Allahın bəndələrindən ötrü)* ***hər bir şeyin*** *(bütün hökümlərin, halal-haramın)* ***müfəssəl izahıdır. O, iman gətirən bir tayfa üçün hidayət və mərhəmətdir».*** *(Yusif 111).* Təfsir alimləri qeyd edirlər ki, ***Muheymin*** – ləfzi özündən əvvəlki kitablara qarşı bir şahid və onları doğrulayan mənasındadır. Yəni Qurani Kərim bu kitablarda olan doğru xəbərləri təsdiq edərkən, bu kitablarda ortaya çıxan təhrifləri, dəyişiklikləri qəbul etməz. Ömər - *radıyallahu anhu* – deyir ki, mən Tövratın bir neçə hissəsini tapmışdım və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə orada yazılan hökmləi göstərdim. Onun mənim bu əməlimdən bərk qəzəbləndiyini gördükdə qorxuya düşdüm ki, nə isə deyər və dərhal dedim: «Rəbb olaraq Allahdan, din olaraq İslamdan, Nəbi olaraq Muhəmməd – *sallallahu aleyhi və səlləm* – dən razı oldum» Peyğəmbər –

---

[702] Buxari, Müslim.

[703] ***Nəsx*** – lüğətdə nəql etmək, axtarmaq deməkdir. ***İstilahi Mənası –*** şəri bir dəlilin hökmünü yaxud da ləfzini Kitab və Sünnətdən bir dəlil ilə qaldırmaq deməkdir. Hökmü qaldırmaq. «Usuli Fikh» şeyx Useymin.

*sallallahu aleyhi və səlləm* – buyurdu: «Vallahi Musa – *əleyhissəlam* – sağ olsaydı o, da mənim dinimə tabe olardı» .

Bəs biz müsəlmanlar, başqa kitablarda olan məlumatlara neçə münasibət bəsləməliyik.

**1.** Quran və Sünnəyə uyğun gələni qəbul edir.

**2.** Quran və Sünnəyə zidd olanları inkar edir.

**3.** Nə ziddir, nə də uyğun – bunları da nə inkar edir, nə də təsdiq edirik. Bunlar İsrailiyyat adlanır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Məndən heç olmasa bir ayə belə insanlara çatdırın. Yəhudilərdən də danışın və bunda heç bir günah yoxdur. Kim bilə-bilə mənim adımdan yalan danışsa keçib Cəhənnəmdə yerini tutsun» .

Qurani Kərim aləmlərin Rəbbinin kəlamı, onun kitabı, səmavi kitabların sonuncusu və sağlam ipidir. Allah onu Abdullahın oğlu Muhəmmədə insanları zülmətdən nura çıxartmaq, doğru yola və Sıratal-Mustəqimə yonəltmək üçün endirmişdi. Həmçinin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bütün insanlara və bütün cinlərə onlara endirilmişi açıqlasın deyə göndərilmişdir. ***«Sənə də Quranı nazil etdik ki, insanlara onlara göndəriləni izah edəsən və bəlkə onlar da düşünüb dərk edərlər».*** *(ən-Nəhl 44).* ***«Biz Quranı sənə hər şeyi izah etmək üçün, müsəlmanlara da bir hidayət, mərhəmət və müjdə olaraq nazil etdik».*** *(ən-Nəhl 89).*

Qurani Kərim Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə bir başa endirilməmişdir. İyirmi üç il ərzində hisə-hissə endirilmişdi. ***«Biz Quranı haqq olaraq nazil etdik, o, da haqq olaraq*** *(həç bir dəyişikliyə uğramadan)* ***nazil oldu. İnsanlara aramla, yavaş-yavaş oxuyasan deyə, biz Quranı hissələrə ayırıb*** *(ayə-ayə, surə-surə)* ***göndərdik».*** *(əl-İsra 106).*

Qurani Kərimdə **114** surə vardır. Bunlardan **87**-si Məkkədə, **27**-si isə Mədinədə nazil edilmişdi. Məkkədə nazil olan surələrə Məkkə surələri, Mədinədə nazil olan surələr isə Mədinə surələri adlanır. Ümumi olaraq **114** surə, **6236** ayə vardır. ***Quran*** **–** qiraət etmək, oxumaq deməkdir. ***Kərim*** **–** Allahın bizə məlum olan **99**-z adından biridir. Səxavətli, kəramətli deməkdir. ***Ayə*** – açıq əlamət, dəlil, işarə, ibrət deməkdir. İlk nazil olan ayə əl-Ələq surəsini ilk **5** ayəsidir. ***Surə*** – yüksək rütbə, şərəf deməkdir.

Qurani Kərimdə ayələr üç qismə bölünür.

**1.** ***Xəbərlər*** (yəni hekayələr).

**2.** ***Hökmlər*** (şəriət qaydaları).

**3.** ***Əqidə*** (Tövhid).

Hər bir müsəlmanın üzərində Allahın haqqıdır ki, Qurani Kərimi öyrənsin, öyrəndikdən sonra başqalarına öyrətsin və ona səmimi qəlbdən sarılsın. ***«Bu nazil etdiyimiz mübarək bir kitabdır. Ona tabe olun ki, bəlkə sizə rəhm olunsun».*** *(əl-Ənam 155).* ***«Rəbbinizdən sizə nazil edilən Qurana tabe olun. Allahı qoyub başqa havadarlara uymayın. Siz öyüd-nəsihətə olduqca az qulaq asırsınız».*** *(əl-Əraf 3).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allahın kitabını götürün və ona səmimi qəlbdən sarılın» . Osman - *radıyallahu anhu* – deyir ki, Peyğəmbər –

---

[704] Buxari.
[705] Buxari.
[706] Müslim, İmam Darimi 2/310, Musnəd 4/367.

*sallallahu aleyhi və salləm* – buyurdu: «Sizin ən xeyirliniz Quranı öyrənən və onu öyrədəndir» .

Qurani Kərimə səmimi qəlbdən sarılmaq nə deməkdir?

Kitabı əzbərləmək, oxumaq, gecə-gündüz namazlarda oxumaq, ayələri üzərində düşünmək, halalı halal, haramı haram qəbul etmək, əmrlərinə bağlanmaq, qadağalarından uzaq durmaq, verdiyi nəsihətlərdən ibrət almaq, buyurduqlarına əməl etmək, mütəşabih buyurduqlarına təslimiyyət göstərmək, onun hüdudlarını aşmamaq, bu kitaba nəsihətçi olmaq (buyurduqlarını səmimiyətlə yerinə yetirmək) və ona dəvət etməkdir. Buna görə də Əhli Sünnə vəl Cəmaat Qurani Kərimin hərf və mənaları ilə Allahın kəlamı olduğuna, ondan gəlib ona dönəcəyinə, Allah tərəfindən endirilmiş olub, məxluq olmadığına, Allahın kəlamı olduğuna iman edirlər. Bu kitab sonsuz hikmət sahibi (***Hakim***) hər şeydən xəbərdar (***Xabir***) olan Allah tərəfindən endirilmişdir.

## QURAN ALLAHIN KƏLAMIDIR

Quran hərfləri və mənaları etibarı ilə Allahın kəlamıdır. Allah Qurani Kərimi söz ilə söyləmiş, Cəbrail – *əleyhissəlam* – onu Allahdan eşitmiş və onu vəhy yolu ilə Peyğəmbəri – *sallallahu aleyhi və salləm* – ə endirmiş, möminlər də ona iman gətirmişlər. Ondan başlamış və Ona da dönəcəkdir. Qurani Kərim hər nə qədər əllərlə yazılırsa yazılsın, dillərlə oxunursa oxunsun, qəlblərdə əzbərlənirsə əzbərlənsin, qulaqlarda dinlənilirsə dinlənsin, gözlər onu görsə də bu hallar onu Rahmən olan Allahın kəlamı olmasından çıxarmaz. Əllər, mürəkkəblər, qələmlər, vərəqlər yaradılmışdır, lakin yazdıqları Quran məxluq deyildir. Dillər, səslər yaradılmışdır, lakin oxuduqları Quran məxluq deyildir. Qəlblər, hafizələr yaradılmışdır, lakin əzbərlənən, hafizələrdə olan Quran məxluq deyildir. Eşidən qulaqlar yaradılmışdır, lakin bu qulaqların duyduqları Quran məxluq deyildir. ***«Çox qiymətli Qurandır. O,*** *(Allah dərgahında)* ***qorunub-saxlanılan bir kitabdır».*** *(əl-Vaqiə 77-78).* ***«Xeyr, bu Quran elm verilmiş kəslərin sinələrində*** *(əzbər)* ***olan açıq-aydın ayələrdir».*** *(əl-Ənkəbut 49).* ***«Onun sözlərini heç kəs dəyişdirə bilməz».*** *(əl-Kəhf 27).* ***«Əgər müşriklərdən biri səndən aman istəsə, ona aman ver ki, Allah kəlamını dinləsin».*** *(ət-Tövbə 6).* ***«Bu yalnız bəşər sözüdür. Biz onu*** *(Cəhənnəmin təbəqələrindən biri olan)* ***Səqərə atacağıq».*** *(əl-Muddəssir 25-26).* Cabir b. Abdullah - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – Məkkədə Həcc mövsümündə insanlara buyurdu: «Rəbbimin kəlamını (sözünü) söyləmək üçün məni öz qövmünə götürəcək bir adam yoxdur mu? Çünki Qureyş Rəbbimin kəlamını söyləməyi qarşısını aldı»[710]. Bəra b. Azim - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: "Yatağa uzandıqda namaz üçün dəstəmaz aldığın kimi dəstəmaz al, sonra sağ tərəfin üstə uzanıb de: ***Allahummə, Əsləmtu Nəfsiy İleykə, Və Fəvvədtu Əmriy İleykə, Və Vəccəhtu Vachiy İleykə, Və Əlcə'tu***

---

[707] Buxari.

[708] ***Mütəşabih*** – dəqiq mənasını bilmək mümkün olmayan Quran ayələri.

[709] Əbu Ruqayyə Təmim b. Əus əd-Dari - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* - buyurdu: «Din nəsihətdir». Kimə? (Ya Rəsulallah!) deyə soruşduq. «Allaha, kitabına, Rəsuluna, müsəlmanların rəhbərlərinə və bütün müsəlmanlara». Müslim.

[710] Əhməd 3/222,339, Əbu Davud 4734, Darimi 3354, Həkim 4220, Tirmizi 2925, İbn Məcə 201, əl-Albani "Səhih Sünən Tirmizi" 2925, "Səhih Sünən İbn Məcə" 167, «Səhih Hədislər Silsiləsi» 1947, «Fikhus Sirə» s. 114.

***Zahriy İleykə, Rağbətən Və Rahmətən İleyk. Lə Məlcə'ə Və Lə Məncəə Minkə İllə İleyk. Aməntu Bikitabikəlləzi Ənzəltə Və Binəbiyyikəl-Ləzi Ərsəltə*** - Allahım! Sənə ümid edərək və Səndən qorxaraq canımı Sənə təslim etdim, işimi Sənə həvalə etdim, üzümü Sənə çevirdim, kürəyimi Sənə etibar etdim. Sığınacaq və Səndən (əzabından) xilas olmaq üçün nicat yeri yalnız Sənə yönəlməkdir. Sənin nazil etdiyin Kitaba və göndərdiyin Peyğəmbərə iman gətirdim!»[711]. Əbu Hənifə – *rahmətullahi aleyhi* – deyir ki: "Bizim Qurani Kərimi tələffüzümüz yaradılmışdır, lakin Quran yaradılmış deyildir"[712]. "Mürəkkəb, kağız və yazıların hamısı yaradılmışdır. Çünki bunlar Qulların felləridir. Lakin Allahın kəlamı yaradılmış deyildir"[713].

Allah – *subhənəhu və təalə* – Qurana bəşər sözüdür deyənləri Cəhənnəm əzabı ilə qorxutmuşdur. İmam Əhməd – *rahmətullahi aleyhi* – deyir ki: "Kim mənin Quranı tələffüz etməyim yaradılmışdır deyərsə və bununla Quranı qəsd edərsə o, Cəhmidir"[714]. Əgər öz tələffüzünü qəsd edərdisə - Cəhmi olmazdı. İmam Əbu Hənifə – *rahmətullahi aleyhi* – deyir: «Kim Quranı eşidir və onun bəşər (insan) sözü olduğuna inanırsa o, kafir olmuşdur. Allah beləsini qınamış, ayıblamış və: ***«Biz onu** (Cəhənnəmin təbəqələrindən biri olan) **Səqərə atacağıq».*** *(əl-Muddəssir 25-26)* deyə buyurmuşdu. Allah Quran üçün: ***«Bu yalnız bəşər sözüdür».*** *(əl-Muddəssir 25-26)* deyəni Cəhənnəm əzabı ilə cəzalandıracağını buyurduqda biz bilmiş və kəsin olaraq başa düşürük ki, Quran bəşərin yaradıcısının sözüdür və əsla insan sözünə bənzəməz»[715]. ***Vakifə*** – deyə bilinən bir cərəyan da vardır ki, onlar deyirlər: «Biz o, Allahın kəlamıdı da demirik. Həmçinin də məxluq olduğunu da söyləmirik». İmam Əhməd – *rahmətullahi aleyhi* – deyir ki: «Bu elmi bilməyib cəhalətindən söyləyərsə ona qarşı dəlillər verərik. Əgər tövbə edib onun Uca Allahın yaradılmamış kəlamı olduğuna iman edərsə məsələ yox. Əksitəqdirdə belə bir kimsə Cəhmiyyədən də pisdir».

Qurani Kərimin yaradılmamış olduğunun dəlilləri bunlardır: ***«…Günəşi, ayı və ulduzları əmrinə tabe edərək yaradan Allahdır. Bilin ki, yaratmaq da, əmr etmək də Ona məxsusdur. Aləmlərin Rəbbi olan Allah nə qədər uca, nə qədər böyükdür!».*** *(əl-Əraf 54).* ***«Əvvəl də, sonunda da əmr Allahındır».*** *(ər-Rum 4).*

Diqqət ediləcək olursa Allah bu iki ayədə yaratmaqla əmr etməyi bir-birindən ayırmış və əmr etmənin yaratmaqdan ayrı bir şey olduğunu bildirmişdir. Çünki Allah Qurani Kərimdə bir şeyi yaratmaq və ya həlak etmək istədikdə bunu əmriylə etdiyini xəbər vermişdir. Əmr isə onun kəlamından başqa bir şey deyildir. ***«Göyün və yerin Onun əmrində durması…».*** *(ər-Rum 25).* ***«Bir şeyi yaratmaq istədiyi zaman Allahın əmri ona ancaq «OL» deməkdir. O, da dərhal olar».*** *(Yasin 82).* ***«O,** (külək) **Rəbbinin əmri ilə hər şeyi məhv edər!».***(əl-Əhqaf 25).* Bütün bu ayələr əmrin yaratmaqdan ayrı bir şey olduğunu, əmrin əvvəli və sonu olmayan Allaha aid olduğunu, onunla dilədiyi zaman dilədiyi şeyi yaradıb, dilədiyi zaman dilədiyi şeyi yox etdiyini açıqca göstərməkdədir. Həmçinin Allah Quranın da əmrindən olduğunu bizə xəbər verməkdədir. ***«Və onlara** (israil oğullarına) **əmrdən açıq-aşkar dəlillər vermişdik…. Sonra** (Ya Muhəmməd!) **səni də əmrdən şəriət sahibi etdik. Sən o, şəriətə tabe ol və***

---

711 Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – demişdir: «Əgər bunu deyib ölsən, fitrət üzərində (heç bir günahı olmadan, anadan doğulmuş uşaq kimi) ölmüş olarsan». Buxari 6311,6313,7488, Müslim 2710, Əbu Davud 5046, Tirmizi 3394, İbn Məcə 3876, Darimi 2683, əl-Albni "Kəlimatu Tayyib" 34, "Mişkət" 2385, "Riyadus Salihin" 1470.

712 "Fikhul Əkbər" s. 58.

713 "əl-Vasiyyə" 74.

714 Əhməd "Sünnə" 131,175, əl-Həllal "Sünnə" 1783,1790, Ləlakai 602, Beyhəqi "Əsmə" s. 264, 1/406, "Səhih".

715 «Əqidətul Təhaviyyə» əl-Albani təhqiqi ilə s. 168.

*(haqqı)* ***bilməyənlərin nəfslərindən gələn istəklərə uyma!».*** *(əl-Casiyə 17-18).* ***«Bu Allahın sizə nazil etdiyi əmridir*** *(buyuruğdur)****».*** *(ət-Talaq 5).* *«(Ya Rəsulum! Əvvəlki Peyğəmbərlərə vəhy nazil etdiyimiz kimi)* ***sənə də beləcə əmrimizdən olan bir vəhy*** *(Quranı)* ***göndərdik…».*** *(əş-Şura 52).* Son ayədə Allah Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə vəhy edilən şeyin Quran olduğunu söyləməkdədir. Əgər Quran yaradılmış olsaydı, vəhy edilməsi doğru olmazdı. O, halda əgər Quran vəhy olunursa deməli yaradılmamışdır. Çünki Quranla danışan Allahın özüdür. Quran Allahın kəlamıdır. Kəlam isə başlı-başına baxımsız bir şey deyildir ki, Allahdan ayrı olsun. Əgər başlı-başına baxımsız bir şey olsaydı biz ona yaradılmış deyərdik. Lakin kəlam onunla danışanın bir sifətidir. Çünki Allahın sifətlərindən heç biri yaradılmamışdır.

Möminlər, Quranın bəşər sözü kimi yaradılmamış olduğuna kəsinliklə iman edirlər. Onun sözü əlbəttə ki, insanların sözünə bənzəməz. Necə ki, Allahın zatı qulların zatlarına bənzəmədiyi kimi, sifətləri də qulların sifətlərinə bənzəməz. Məs: Bir kimsə Quran oxuyarkən ***Əlhəmdulilləhi Rabbil Aləmin*** **–** deyərsə, ondan eşidilən bu söz Allahın kəlamıdır. O, kimsənin sözü deyildir. Onu oxuyan şəxs isə Allahın səsi ilə deyil öz səsi ilə oxumuş olur. O, özü yaradılmış olduğu üçün, səsi də yaradılmışdır (məxluqdur). İmam Əbu Hənifə – *rahmətullahi aleyhi* – deyir: «Quran qulların kəlamı kimi yaradılmış deyildir» .

Quran və ya Quranın bir hissəsi məxluqdur deyən bir kimsə, insanı İslamdan bütünlüklə çıxardan ən böyük küfr etməklə kafir olur. Çünki Quran Allahın kəlamıdır, ondan gəlmiş və ona da dönəcəkdir. ***«Siz kitabın bir hissəsinə inanır, digər həssəsini isə inkar edirsiniz».*** *(əl-Bəqərə 85).*

Allah istədiyi təqdirdə, istədiyi zaman, istədiyi şəkildə, istədiyi kimsələrlə onların başa düşdükləri şəkildə bir kəlam ilə danışır. ***«Əgər Rəbbinin sözlərini yazmaq üçün dəryalar mürəkkəb olsaydı və bir o, qədər ona əlavə olunsaydı yenə də Rəbbinin sözləri tükənməzdən əvvəl onlar tükənərdi».*** *(əl-Kəhf 109).* ***«Əgər yerdə hər bir ağac qələm olsaydı və dəryalar mürəkkəb olsaydı və yeddi dərya belə ona qoşulsaydı yenə də Rəbbinin sözləri tükənməzdi. Həqiqətən Allah yenilməz qüvvət və hikmət sahibidir».*** *(Loğman 27).* ***«Onun sözlərini dəyişdirə biləcək bir kimsə yoxdur».*** *(əl-Ənam 115).*

Bəzi İslam alimlərinin Quran haqqında sözləri.

Əbu Hənifə – *rahmətullahi aleyhi* – deyir: «Allah öz kəlamı ilə danışır. Kəlam onun əzəli sifətidir» . «Quran məxluq deyildir» . «Quran Allahın Kəlamı olub, müshaflarda yazılmış, qəlblərdə (zehinlərdə) hifz edilmiş, dillərdə oxunmuş və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə enmişdir» . «Allahın kəlamı yaradılmış deyildir. Fəqət Musa və digər yaradılmışların kəlamı yaradılmışdır. Quran isə Allahın kəlamı olub əbədi və əzəlidir. Onların (yaradılmışların) sözləri deyildir» . «Hər kim Allahın kəlamının yaradılmış olduğunu söyləyərsə o, Allahı inkar etmiş olur» . "Allahın kəlamı Ondan ayılmadan oxunan, yazılan və hifz olunandır"[722]. "Kuran Allahı kəlamıdır və Ondan necə olduğu bilinmədən söz olaraq çıxmış, Allah bunu

---

716 «Əqidətul Təhaviyyə» əl-Albani təhqiqi ilə s. 168.
717 «Fiqhul Əkbər» s. 301.
718 «Fiqhul Əkbər» s. 301.
719 «Fiqhul Əkbər» s. 58.
720 «Fiqhul Əkbər» s. 58.
721 «əl-Vasiyyə» s. 74.
722 əl-Vasiyyə s. 74.

Peyğəmbərinə vəhy etmiş, möminlər də bu minval üzərə onun haqq olduğunu təsdiq etmişlər və Quranın həqiqətən də Allahın həqiqi kəlamı olduğuna tam bir yəqinliklə inanmışlar"[723]. İbn Abdul Bər Abdullah b. Nafin – *rahmətullahi aleyhi* – rəvayət edir: «Məlik b. Ənəs – *rahmətullahi aleyhi* – deyirdi ki: «Kim Quran yaradılmışdır desə döyülür, tövbə edənə qədər həbs edilməlidir» . «Ey Abdulah dedi: «Quran məxluqdur deyən bir kimsə haqqında nə deyirsən?». Məlik: «O, bir zındıqdır, onu öldürün» deyə cavab verdi . Laləkai, Rəbi b. Süleymandan rəvayət edir ki, Şafii – *rahmətullahi aleyhi* – deyir: «Kim Quran yaradılmışdır deyərsə kafirdir» . Laləkai, Məlik b. əl-Attardan rəvayət edir ki, Əhməd b. Hənbəl – *rahmətullahi aleyhi* – deyir: «Quran Allah kəlamıdır, məxluq deyildir. Allahın kəlamı Ondandır və Ondan olan heç bir şey məxluq deyildir» . Amr b. Dinar – *rahmətullahi aleyhi* – deyir: «Yetmiş ildən bəri yaşadığım insanlardan yalnız bunu eşidərdim: «Allah yaradandır, Ondan başqa hər şey yaradılmışdır. Bundan yalnız Quran xaricdir. Çünki Quran Allahın kəlamı olub yaradılmamışdır. Ondan başlamış və Ona da dönəcəkdir» .

«O, Quran ondan başlamış və ona da dönəcəkdir» sözlərinə gəlincə, buradakı gəliş ***əl-Bəd*** – başlamaqdan törənmişdir. Ondan başlamışdır sözünün mənası isə onu ilk dəfə kəlam olaraq söyləyən Allahdır. Yəni onunla ilk və başlanğıc olaraq danışan Odur. «Ona dönəcəkdir» sözünün mənası isə: «Quranla danışmaq sifəti Allaha dönər. Çünki Quranla danışan Allahdır. Danışmaq da danışanın bir sifətidir» deməkdir. Sonda isə müshaflardan, hafizələrdən qaldırılacağı vaxt – axır zamanda ona dönəcəkdir. Xuzeyfə b. Yəmən - *radıyallahu anhu* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü İslam paltarın naxışları silinib yox olduğu kimi silinib yox olacaqdır. Belə ki, (yer üzündə) nə orucun, nə namazın, nə həccin, nə də sədəqənin nə olduğu bilməyəcəklər. Allah bir gecədə Quranı qaldıracaq və yer üzündə ondan bir ayə belə qalmayacaqdır. O, zaman insanlardan yaşlılar və böyüklər qalacaqlar və deyəcəklər: «Biz babalarımızın bu kəlməni: «***Lə İlə İlləllah***» - söylədiklərini eşitdik. Buna görə də biz də onu söyləyirik» .

## QURANİ KƏRİMİN TƏFSİRİ

Qurani Kərimi təfsir etməyin bir neçə növü vardır:

**1.** ***Quranı Quranla Təfsir Etmək:*** Məs: ***«Oğru kişi ilə oğru qadının gördükləri işin əvəzi kimi Allahdan cəza olaraq*** *(sağ)* ***əllərini kəsin».*** *(əl-Maidə 38)* ayəsi buna ən gözəl misaldır. Lakin Peyğəmbərin - *sallallahu aleyhi və səlləm* – oğru sözünü açıqlamış və demişdir: «Yalnız dinarın dördə birini və ya ondan atrığını oğurlayanın əli kəsilir» . ***«İman gətirirb imanlarını zülmlə qarışdırmayanlar əmin-amanlıqdadırlar. Haqq yola yönəlmişlər də onlardır!».*** *(əl-Ənam 82).* Peyğəmbərin - *sallallahu aleyhi və səlləm* – in səhabələri bu ayədə deyilən «***ZÜLM***» sözünü ümumi mənada

---

[723] əl-Albani "Şərh Əqidətul Təhaviyyə" s. 168.
[724] «əl-İntiqa» s. 35.
[725] «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Cəmaat» 1/249, Hiylə 6/325.
[726] «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Cəmaat» 1/252.
[727] «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Cəmaat» 1/157.
[728] Buxari «Xaliqu Əfəlil İbad» 1, «Tarihul Kəbir» 2/338, Beyhəqi «Sunnənul Kubra» 10/205, İbn Teymiyyə «Minhəc Sünnə» 2/253, İbn Batt «əl-İbanə» 2/548.
[729] İbn Məcə 4049, Həkim 8460, 8646, İbn Həcər «Fəthul Bəri» 13/16, əl-Albani «Səhih Hədislər Silsiləsi» 87, «Səhih Cəmius Səği» 8077.
[730] Buxari, Müslim.

başa düşdüklərindən dolayı ayənin mənası onlara qaranlıq qaldı. Ona görə də Peyğəmbərin - *sallallahu aleyhi və səlləm* – in yanına gəlib dedilər: «Ey Allahın Rəsulu! Bizlərdən kim öz imanını zülmlə qarışdırmır? Peyğəmbərin - *sallallahu aleyhi və səlləm* – buyurdu: «O, zülm deyildir. Bu zülm sizin başa düşdüyünüz zülm deyildir. Bu zülm şirkdir. Heç Loğmanın sözünü eşitmədinizmi: ***«Doğurdan da Allaha şərik qoşmaq böyük zülmdür».*** *(Loğman 13)*[731]. Əgər Peyğəmbərin - *sallallahu aleyhi və səlləm* – onların bu səhvini düzəltməsəydi və həmin zülmün şirk olduğunu açıqlamasaydı, biz də eyni səhvi edəcəydik. Lakin Allah öz lütfü və Peyğəmbərin - *sallallahu aleyhi və səlləm* – in sünnəsi ilə bizi bu xətadan qorudu.

**2. *Quranı Sünnə Ilə Təfsir Etmək*:** Məs: Allah, Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – i Peyğəmbər olaraq seçmiş, ona Öz risalətini vermiş, Quranı Kərim adlı kitabını ona nazil etmiş və bu kitabını insanlar üçün açıqlamağı əmr etmişdir. ***«Sənə də Quranı nazil etdik ki, insanlara onlara göndəriləni*** *(hökmləri, halal-haramı)* ***açıqlayasan və bəlkə onlar da düşünüb dərk edərlər».*** *(ən-Nəhl 44).* Ayədə qeyd olunan açıqlama iki cürdür.

1). Quranın sözlərinin və tərtibinin açıqlanması. Bu nazil olmuş Quranı təbliğ etmək, onu gizlətməmək və onu olduğu kimi ümmətə çatdırmaqdır. ***«Ya Peyğəmbər! Rəbbin tərəfindən sənə endirilmiş olanı*** *(Quranı)* ***təbliğ et. Əgər bunu etməsən Allahın risalətini*** *(sənə həvalə etdiyi elçilik, peyğəmbərlik vəzifəsini)* ***yerinə yetirmiş olmazsan. Allah səni insanlardan qoruyacaqdır. Allah kafir camaatı düz yola yönəltməz».*** *(əl-Maidə 67).* Aişə - *radıyallahu anhə* – rəvayət edir ki: «Kim - Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ona nazil olan şəriətdən hər hansı bir şeyi gizlədib insanlara çatdırmayıb desə həqiqətən də Allaha qarşı böyük böhtan atmış olar». Bu sözlərdən sonra: ***«Ya Peyğəmbər! Rəbbin tərəfindən sənə endirilmiş olanı*** *(Quranı)* ***təbliğ et»*** ayəsini oxudu[732]. İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: «İnsanlara endiriləni onlara açıqlayasan – sözü isə Rəbbindən enəni deməkdir. Sən onu daha yaxşı bilirsən. Yenə sənin Adəm oğullarının seyyidi və onların ən xeyirlisi olduğunu bildiyimiz üçün onlara Quranı açıqlayıb öyrətməyin üçün göndərdik. Allah Rəsulu da risaləti təbliğ etdi. Qəlblərdə və ağıllarda olan bulanlığı apardı, Allah onunla qapalı qəlbləri və kar qulaqları İslama açdı. Əgər Allah Rəsulu risaləni təbliğ etməzsə, ondan başqa kim təbliğ edə bilə? Aləmlərə rəhmət olaraq göndərilən Rəsul bunu açıqlamasa kim bunu açıqlaya bilə? Allah qulu və Rəsulu olan Muhəmməd - *sallallahu aleyhi və səlləm* – ə risaləti insanlığa çatdırmasını istədi. O. da bu əmri ən gözəl şəkildə yerinə yetirdi və risalətini haqqıyla yerinə yetirdi. Ümməti də onun bu risaləti təbliğ etdiyi barədə şahidlik etdi. Cabir b. Abdullah – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsululah – *sallallahu aleyhi və səlləm* - vida həcci zamanı xütbəsində buyurdu: «Mən sizə dində olan hər bir şeyi çatdırdımmı?» Səhabələr: «Bəli, ya Rəsulullah!» Allah Rəsulu şəhadət barmağını qaldıraraq: «Ya Rəbbim! Sən şahid ol ki, mən onlara hər bir şeyi çatdırdım»[733].

2). Ümmətin dərk etmədiyi sözün, cümlənin və ya ayənin mənasını açıqlamaq. Bu anlaşılmamazlıq çox vaxt ümumi, qeyri müfəssəl və mütləq məna daşıyan ayələrdə olur. Bu halda sünnədən götürülən dəlillərlə ümumi ayələr xüsusiləşir, qeyri-

---

[731] Buxari, Müslim.
[732] Buxari, Müslim.
[733] Müslim, Əbu Davud 1905, İbn Məcə 3074, İmam Əhməd 3/313,371, əl-Albani «Muhtasarul Uluvv» s.83, «İrvalul Ğəlil» 4/201,209, «Mişkətul Məsabih» təhqiqi 2/783,787.

müfəssəllər açıqlanır və mütləq məna daşıyanlar isə müəyyənləşir. Bütün bunlar Peyğəmbərin - *sallallahu aleyhi və səlləm* – in sözləri, əməlləri və görüb inkar etmədikləri işlərdə sübuta yetir. ***«O, kefi istəyəni danışmır. Bu ancaq*** *(Allah dərgahından)* ***nazil olan bir vəhydir».*** *(ən-Nəhl 44).* ***«Ey iman gətirənlər! Peyğəmbər sizi sizləri dirildəcək bir şeyə*** *(imana, haqqa)* ***dəvət etdiyi zaman Allahın və Onun Peyğəmbərinin dəvətini qəbul edin. Bilin ki, Allah insanla onun qəlbi arasına girər və siz axırda onun hüzuruna cəm ediləcəksiniz».*** *(əl-Ənfal 24).*

Sünnə olmadan Allahın kitabı olan Qurani Kərimi başa düşmək mümkün deyildir. Sünnənin Qurani Kərimin təfsirində, başa düşülməsində böyük bir rolu vardır və onların hər ikisi də bir-birindən ayrılmazdılar. ***«Allahın evlərinizdə oxunan ayələrini və hikməti*** *(Sünnəni)* ***xatırlayın…»*** *(əl-Əhzab 34).* ***«…Sənin ayələrini onlara oxusun Kitabı və hikməti onlara öyrətsin…»*** *(əl-Bəqərə 129).* ***«…Çünki Allah sənə Quranı və hikməti nazil edərək bilmədiklərini öyrətdi»*** *(ən-Nisa 113).* ***«…Onlara Kitabı və hikməti öyrədər»*** *(əl-Cumuə 2).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mən sizə iki şeyi qoyub gedirəm. O, ikisinə möhkəm bağlandığınız müddət əsla yolunuzdan ayrılmayacağsınız. Allahın Kitabı və Allahın elçisinin Sünnəsi» . İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Aranızda elə şeyləri tərk edirəm ki, onlara bağlandığınız müddət əbədi olaraq azmayacaqsınız. Allahın Kitabı və Peyğəmbərin Sünnəsi» . Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər ikisidə mənimlə Hovuzun ətrafında görüşəcəkləri vaxtadək bir-birindən əsla ayrılmazlar» . Muaz b. Cəbəl - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – onu Yəmənə göndərərkən belə buyurmuşdu: «Sənə bir məsələ haqqında hökm verməyini istəyənlərə necə hökm verəcəksən?» Muaz: «Allahın Kitabı ilə hökm verəcəyəm» dedi. Peyğəmbər: «Əgər Allahın Kitabı olmasa?» Muaz: «Onda Allahın elçisinin sünnəsi ilə (hökm verəcəyəm)» . Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həqiqətən mənə Quran və onun misli qədəri verilmişdir» . Abdullah b. Amr - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim mənim sünnəmdən üz çevirərsə məndən deyildir» . Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mənim ümmətimin hamısı Cənnətə daxil olacaq. Yalnız Cənnəti istəməyənlərdən başqa». Səhabələr: «Ya Rəsulullah! Kimlərdir onlar?». Peyğəmbər: «Kim mənə itaət edərsə Cənnətə daxil olar, kim mənə itaət etməzsə onlar Cənnəti istəməyənlərdir» . Cabir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər -

---

[734] Qasimi «Məhasinut Təvil» 8/35 – kitabında deyir ki: «Uca Allah insanın qəlbinə hakimdir. O, qəlbi istədiyi kimi çevirir. Əgər insanı hidayətə yönəltmək istəyirsə qəlbi ilə küfr arasına, yox əgər onun zəlalətini istəyirsə qəlbi ilə imanı arasına girir. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ey qəlbləri çevirən Allahım! Qəlblərimizi sənə itaətə yönəlt» Müslim, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Adəm oğullarının qəlbləri Rəhmanın iki barmağı arasında vahid bir qəlb kimidir. Onları istədiyi kimi çevirir» Müslim. Qatadə - *radıyallahu anhu* –: «O, insana çox yaxındır, onu gizli saxladığından, sirlərindən heç biri Onun üçün gizli qala bilməz». Mücahid - *radıyallahu anhu* –: «İnsan ilə qəlbi arasına girərək dərk etməsinə imkan verməz». İnsan ilə qəlbi arasına ölüm vasitəsilə girər. O, halda ölümdən qabaq işlər görməyə tələsin. Suddi: «İnsan ilə qəlbi arasına girər. Bilavasitə Onun icazəsi olmadan nə imana gələ bilər, nə də kafir ola bilər».

[735] İmam Məlik «Muvatta» 899 Qədər 1, hədis 3. 2/A, Həkim «Mustədrək» 1/93, əl-Albani «Cəmius Səğir» 3/39.

[736] Həkim «Mustədrək» 1/93, əl-Albani «Cəmius Səğir» 3/39.

[737] Həkim «Mustədrək» 1/93, əl-Albani «Cəmius Səğir» 3/39.

[738] Darimi «Sünən» səh 57.

[739] Əbu Davud.

[740] Buxari, Əhməd «Musnəd» 2/158.

[741] Buxari.

*sallallahu aleyhi və səlləm* – yuxuda olarkən mələklər onun yanına gəldilər. Mələk: «O, yatıb». Digəri isə: «Onun gözləri yatıb, qəlbi isə oyaqdır» dedi. Sonra bir-birilərinə: «Sizin bu dostunuz haqda məsəl vardır. O, bir ev tikmiş kimsəyə bənzəyir. Evi tikdikdən sonra orada qonaq süfrəsi açır. Sonra qonaqları çağırmaq üçün bir nəfər göndərir. Kim bu çağırışa cavab verərsə evə daxil olar və yeməkdən yeyər. Çağırışa cavab verməyənlər isə evə daxil olmaqdan və yemək yeməkdən məhrum olarlar. Onlar: «Yuxunu açıqlayın ki, o başa düşsün». Digər mələk: «Onun gözləri yatmış, qəlbi isə oyaqdır» dedi. Sonra yuxunu açıqlayaraq: «Ev Cənnətdir. Çağıran isə Muhəmməddir. Kim Muhəmmədə itaət edərsə Alaha itaət edər, Muhəmmədə asi olan isə Allaha asi olandır. Məhəmməd (mömin ilə qeyri mömini) bir-birindən fərqləndirir» . Əbu Musa - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mən və Allahın mənimlə göndərdiyinin misalı bir tayfa arasına gəlib: «Ey qövmüm! Mən öz gözlərimlə qoşun gördüm. Mən sizləri açıq-aşkar xəbərdar edirəm ki, özünüzü qoruyasınız. Qövmün bir hissəsi onun sözünü dinləyib arxayınlıqla həmən yerdən uzaqlaşır, digər hissəsi isə onun bu xəbərini təqzib edib olduqları yerdən tərpənmirlər. Deyilən qoşun gələrək onların hamısını məhv edir» deyən kimsəyə bənzəyir. Bu misal mənə itaət edən və mənim buyurduqlarıma tabeçilik göstərən və mənə asi olub buyurduğum haqqı yalan hesab edən adama bənzəyir» .

***«Peyğəmbər sizə nə verirsə onu götürün, nəyi qadağan edirsə, ondan əl çəkin. Allahdan qorxun. Həqiqətən, Allahın cəzası çox şiddətlidir».*** *(əl-Həşr 7).* İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: «Sizə nə əmr edirsə onu yerinə yetirin və sizə hər nəyi qadağan edərsə ondan uzaq durun. Çünki o, ancaq xeyirli olanı əmr edir və ancaq şər olanı qadağan edir». ***«Allah ona lənət etdi. O, isə dedi: «Əlbətdə mən sənin bəndələrindən müəyyən qismini ələ alacağam. Onları hökmən sapdıracağam, xülyalara salacaq, heyvanların qulaqlarını kəsməyi və Allahın yaratdıqlarına dəyişikliklər verməyi əmr edəcəyəm. Allahı atıb şeytanı özünə dost tutan şəxs əlbətdə açıq-aşkar ziyana uğramışdır».*** *(ən-Nisa 118,119).* Abdullah b. Məsud - *radıyallahu anhu* – deyir ki: «Allah döymə (nakolka) döyən, döymə döydürən qadınlara, qaşlarını aldıranlara, gözəllik üçün Uca Allahın xilqətini (Allahın verdiyi surəti) dəyişdirərək dişlərini hamarlandıraraq incələdən qadınlara lənət etmişdir. Bu sözlər Abdullahın evində olan Umm Yaqub kimi tanınan Əsəd övladlarından olan bir qadına çatdı. Abdullahın yanına gələrək belə dedi: «Mənə xəbər verildiyinə görə sən filan-filan sözləri demisən». Abdullah: «Peyğəmbərin - *sallallahu aleyhi və səlləm* – in lənət etdiyi və Uca Allahın Kitabında da (lənətlə) yad edilmiş kimsələri mən nəyə görə lənətləməməliyəm?» Qadın: «Məndə heç şübhə yoxdur ki, Quranı başdan axıra qədər oxumuşam və bilirəm. Sənin bu dediyini orada görməmişəm». Abdullah: «Əgər sən Quranı həqiqətən oxumuş olsaydın onu tapardın və: ***«Peyğəmbər sizə nə verirsə onu götürün, nəyi qadağan edirsə, ondan əl çəkin»*** buyurduğunu orada oxumamısanmı?». Qadın oxuduğunu təsdiq etdikdə, Abdullah dedi: «Peyğəmbərin - *sallallahu aleyhi və səlləm* – bu dediklərini qadağan etmişdir». Qadın: «Məncə sənin ailən də bunu edir» dedi. Abdullah: «Get, bax!» dedi. Qadın getdi, lakin dediyi kimi bir şey görmədi. O, qayıdaraq: «Xeyr, dediyim kimi bir şey görmədim, deyincə, Abdullah: «Əgər dediyin kimi olsaydı bizimlə birlikdə olmazdılar» . Cəmil Zeynu (Allah ondan razı olsun)

---

742 Buxari.
743 Buxari, Müslim.
744 Buxari, Müslim, İbn Kəsir 4/336.

deyir ki, Məkkədə Məscidul Haramda dərs deyirdim. Hacılara Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in saqqal saxlamağı və bığları qısaltmağı tövsiyə edirdim. Dərsdə olanlardan bir nəfər ayağa qalxaraq məndən bunun vacibliyinə dair Qurani Kərimdən dəlil gətirməyimi xahiş etdi. Mən də ona: ***«Peyğəmbər sizə nə verirsə onu götürün, nəyi qadağan edirsə, ondan əl çəkin»*** ayəsini oxu dedim və sonra Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in saqqal saxlamağı əmri vardır» dedim. O, da: «Doğru söylədin» dedi.

Lakin günümüzdə ***Quranilər*** (Qurançılar) deyilən azğın bir dəstə vardır ki, onlar sünnəni inkar edərək yalnız Quranı götürür və onunla da kifayətlənirlər. Quranı öz istəklərinə və ağıllarına görə təfsir edirlər. Namazı ərəbcə deyil hansı xalqa mənsubdurlarsa o, dildə də qılırlar. Namazları istədikləri vaxt və istədikləri sayda qılırlar. Çünki namazın qılınma şəkili haqda Qurani Kərimdə bir ayə belə gəlməmişdir. Onlar da hədisləri qəbul etmədikləri üçün bu ibadəti də istədikləri kimi edərlər. Həmçinin zəkat, oruc və s. iadətləri də öz ağıllarına görə edərlər. Bu azğın dəstənin ən iyrənc fikirlərindən biri də budur ki, onlar Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in son peyğəmbər olduğunu qəbul etməzlər və deyərlər ki, ondan sonra da peyğəmbər gələcək. Bu azğınlar içərisində olan daha azğınları isə özləri öz aralarında özlərinə görə bilikli olanını Peyğəmbər seçərlər və onun əmr və qadağaları ilə oturub durarlar. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – bu azğınlar haqqında buyurur: «Qarnı tox olan bir kimsənin oturacağına dirsəklənmiş hər hansı birinizə mənim əmr etdiyim və ya qadağa qoyduğum bir iş barəsində söylənilərsə o: «Belə bir şey bilmirəm! Biz yalnız Allahın kitabında gördüklərimizə tabe oluruq» deyən görməyim (Başqa rəvayətdə: Siz yalnız bu Quranı götürün. Orada tapdığınız haramları haram sayın, halalları da halal sayın. Məgər ev eşşəkləri və yırtıcı dişli vəhşi heyvanlar sizlərə haram deyilmi deməsinə az qalıbdır)» .

**3. *Quranı Səhabələrin Sözləri Ilə Təfsir Etmək:*** Məs: İbn Abbas, İbn Məsud - *radıyallahu anhum* – və s. səhabələrin təfsirləri olduqca böyük əhəmiyyət kəsb edir. Çünki onlar peyğəmbərə yoldaş olmuş və elmi ondan öyrənmişlər. ***«Rəhman ərşə ucaldı».*** *(Ta ha 5)* ayəsinin təfsirində İbn Abbas - *radıyallahu anhu* – deyir ki: «***İstiva*** – yüksəldi deməkdir» . ***«Qadınlara toxunmuş olduqda…».*** *(ən-Nisa 43)* ayəsinin təfsirində İbn Abbas - *radıyallahu anhu* – deyir ki: «Məqsəd cimadır (cinsi əlaqə)». İbn Məsud - *radıyallahu anhu* – isə deyir ki: «Toxunma (qadına əl vurmaq) cima deyildir». Çünki Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – xanımlarından birisini öpdükdən sonra dəstəmaz almadan namaz qıldığına dair xəbər səhihdir .

**4. *Quranı Tabiinlərin Sözləri Ilə Təfsir Etmək:*** Məs: Qurani Kərimin Tabiinlərin sözləri ilə təfsir edilməsi də eynilə çox əhəmiyyətlidir. Çünki onlar bu bilikləri Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – dən öyrənmiş möhtərəm səhabələrdən almışlar. Mücahid İbn Abbasın tələbəsi, İbn Abbasın azadlısı İkrimə, Ata b. Əbi Rəbah, Həsənul Bəsri – Əli - *radıyallahu anhu* – nun tələbəsi, Məsruq b. əl-Əsədi, Qatadə, əd-Dəhhaq b. Muzəhim, Səid b. Musəyyib və s. ***«Sonra səmaya istiva etdi».*** *(əl-Bəqərə 29)* ayəsinin təfsirində Əbul Aliyə – *rahmətullahi aleyhi* – deyir ki: «Yəni

---

[745] Tirmizi, Əbu Davud, Həkim, İmam Əhməd, İbn Məcə əl-Albani «Səhihul Cəmi» 2643.
[746] İbn Həcər «Fəthul Bəri» 13/406.
[747] İbn Kəsir 1/502.

yüksəldi». Mücahid – *rahmətullahi aleyhi* – deyir ki: «***İstiva*** **–** ərşin üstünə» deməkdir .

**5.** ***Quranın Ərəb Dilinə Görə Təfsiri:*** Məs: Quranın ərəb dilinə uyğun olaraq təfsir edilməsi də çox böyük əhəmiyyət kəsb edir. Çünki: ***«Biz onu ərəbcə bir quran olaraq nazil etdik ki, bəlkə anlayasınız».*** *(Yusif 2).* İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Allah Yəhudilərə «***Hittə***» demələrini əmr etdi. Onlar isə o, sözü təhrif edərək «***Hintə***» dedilər. Uca Allah da bizə ərşin üzərinə «***İstiva***» etdiyini söylədiyi halda təfsirçilər onu «***İstila***» etdi kimi yozdular. İndi isə bunların əlavə etdikləri «***Ləm***» hərfinin Yəhudilərin əlavə etdiyi «***Nun***» hərfinə nə qədər oxşadığına diqqət edin . ***«Biz yalnız Sənə ibadət edirik və yalnız Səndən kömək diləyirik!».*** *(əl-Fatihə 5).* İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Yaratmağın və əmr etməyin, kitabların və şəriətlərin, savabın və əzabın sirri bu iki kəlimədə ifadə edilmişdir. Bunlar Ubudiyyətin – ibadət etmə, qulluq etmə və tövhidin – əksəriyyətini təşkil edirlər. Uca Allah dörd kitab nazil etmişdir. Bunların hamısının mənalarını Tövrat, İncil və Quranda cəmləşdirmişdir. Quranın bütün mənasını isə Fatihə surəsindəki beşinci ayədə cəm etmişdir» .

## QURANİ KƏRİMİN FƏZİLƏTİ

***«Rəbbinizdən sizə nazil edilən Qurana tabe olun. Allahı qoyub başqa həvadarlara uymayın. Siz öyüd-nəsihətə olduqca az qulaq asırsınız».*** *(əl-Əraf 3).* ***«Quran oxunan zaman onu dinləyin və susun ki, bəlkə rəhm olunasınız».*** *(əl-Əraf 204,205).* ***«Həqiqətən bu bir öyüd-nəsihətdir. Kim istəsə Rəbbinə tərəf yol tutar».*** *(Dəhr 29).* ***«Bu nazil etdiyimiz mübarək bir kitabdır. Ona tabe olun ki, bəlkə sizə rəhm olunsun».*** *(əl-Ənam 155).* ***«Onunla diri olanları qorxutsun və o, deyilən söz kafirlər barəsində gerçək olsun».*** *(Yasin 70).* ***«Biz Quranda möminlər üçün şəfa və mərhəmət olan ayələr nazil etdik…».*** *(əl-İsra 82).* ***«Biz onu siz başa düşəsiniz deyə ərəbcə bir*** *(Quran)* ***olaraq nazil etdik».*** *(Yusuf 2).* ***«Biz onu başa düşəsiniz deyə ərəbcə Quran etdik».*** *(əz-Zuxruf 3).* ***«Ona ancaq təmamilə təmiz olanlar toxuna bilər. O, aləmlərin Rəbbi tərəfindən göndərilmişdir».*** *(əl-Vaqiə 79,80).* ***«Biz hər hansı bir ayanin hökmünü ləğv edir və ya onu unutdururuqsa, ondan daha yaxşısını, yaxud da ona bənzərini gətiririk. Allahın hər şeyə qadir olduğunu bilmirsinizmi».*** *(əl-Bəqərə 106).* Osman - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizin ən xeyirliniz (Başqa rəvayətdə: Ən üstününüz) Quranı öyrənən və onu öyrədəndir» . Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Quranı Kərimi oxuyan və bu işdə mahir olan kimsə Allahın elçiləri, möhtərəm və itaətkar mələklərlə birlikdə olacaqdır. Quranı kəkələyərək, çətinliklə oxuyan kimsəyə isə iki əcir vardır» . Əbu Musa əl-Əşari - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Quran oxuyan mömin iyi və dadı şirin olan limon (***Utruccu***) kimidir. Quran oxumayan mömin isə dadı olub, iyi olmayan xurma kimidir. Quran oxuyan münafiq iyi xoş, lakin dadı acı olan reyhan kimidir. Quran oxumayan münafiq isə iyi olmayan,

---

[748] Buxari 8/175.
[749] İbn Qeyyim «Qəsidətul Nuniyyə».
[750] İbn Qeyyim «Mədaricus Salihin».
[751] Buxari 5027.
[752] Buxari 4937, Müslim 798.

lakin dadı acı olan ***Hənzələ*** (qarpıza bənzər tərəvəz) kimidir» . İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və salləm* – buyurdu: «İki fəzilət sahibindən başqa heç kəsə həsəd (qiptə) caiz deyildir. Onlardan biri Allah tərəfindən bir kimsəyə Quran biliyi verilə və o, da onu gecə və gündüz oxuyar. Digəri isə Allah tərəfindən bir kimsəyə mal-dövlət verilmişdir. O, da onu gecə və gündüz (Allah yolunda) xərcləyər (Başqa rəvayətdə: Allah bir kimsəyə mal və elm vermişdir. O, da elmi ilə malından Allah yolunda xərcləyər. Bir başqa adama da elm verildiyi təqdirdə, mal verilməmişdir. O da: «Əgər mənim də bu adam kimi malım olsaydı onun etdiyi əməlinin bənzərini mən də edərdim». Bu iki kimsə əcr baxımından eynidirlər )» . Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və salləm* – buyurdu: «Şübhəsiz ki, Allah bu Quran vasitəsi ilə bir qrup insanları ucaldacaq, digərlərini isə alçaldacaqdır» . Bəra b. Azim - *radıyallahu anhu* – rəvayət edir ki, bir nəfər Kəhf surəsini oxuyurdu. Yanında isə iplə bağlı atı da var idi. Bu vaxt bir bulud kölgə salaraq ona yaxınlaşmağa başladı. At isə hürkdü. Səhəri bu kimsə Peyğəmbər - *sallallahu aleyhi və salləm* – in yanına gələrək olanları ona başa saldı. Peyğəmbər: «Bu bir səkinət olub Quran üçün enmişdir”[757]. (Başqa rəvayətdə: Useyd - *radıyallahu anhu* – baş verənləri Peyğəmbər - *sallallahu aleyhi və salləm* – xəbər verdikdə o, buyurdu: «Bilirsənmi bu nə idi?». Mən: «Xeyr» deyə cavab verdim. Peyğəmbər: «Bunlar Mələklər idi. Sənin səsinə gəlmişlər. Əgər (səhərə qədər) oxumağa davam etsəydin bu mənzərəni insanlar da seyr edərdilər və onlar heç kəsə də gizli qalmazdırlar)» . İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və salləm* – buyurdu: «Kim Allahın kitabından bir hərf oxuyarsa onun üçün bir yaxşılıq vardır. Yaxşılıq da on qat qarşılıqlı əcr alır. Mən ***Əlif, Ləm, Mim*** – bir hərfdir demirəm. ***Əlif*** – bir hərf, ***Ləm*** – bir hərf, ***Mim*** – bir hərfdir» deyirəm . İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və salləm* – buyurdu: «Daxilində (qəlbində) Qurandan bir şey olmayan insan xaraba ev kimidir» . Abdullah b. Amr - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və salləm* – buyurdu: «(Qiyamət günü) Quran hafizinə: «Oxu və yüksəl, dünyada ikən açıq-açıq, dənə-dənə oxuduğun kimi oxu. Sənin Cənnətdəki məqamın oxuya biləcəyin ən son ayətə bağlıdır» deyiləcəkdir . Əbu Musa - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və salləm* – buyurdu: «Quranı tez-tez oxuyun. Qəlbim əlində olan Allaha and olsun ki, Quranın hafizələrdən qaçması bağlı dəvənin ipindən boşalıb qaçmasından daha tezdir» . İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və salləm* – buyurdu: «Quran hafizi bağlanmış dəvəyə bənzəyir. Əgər dəvə sahibi heyvanı sıx bir şəkildə bağlayıb (tutarsa) dəvəni saxlamaq ona nəsib olar. Yox əgər buraxarsa o, da (qaçıb) gedər» . Əbu Lubabə Bəşir b. AbdulMunzir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və*

---

[753] Buxari 5059, Müslim 797.
[754] İbn Məcə 4228, Əhməd 4/23.
[755] Buxari 73, Müslim 815.
[756] Müslim 817.
Müslim 796.
[758] Buxari 5018, Müslim 795, 796.
[759] Tirmizi 2919.
[760] Tirmizi 2912, əl-Albani zəif.
[761] Əbu Davud 1664, Tirmizi 2915.
[762] Buxari 5033, Müslim 791.
[763] Buxari 5023, Müslim 792.

*səlləm* – buyurdu: «Quran oxuyarkən səsini gözəlləşdirməyən (avazla oxumayan) bizdən deyildir» . İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – mənə buyurdu: «Ey İbn Məsud! Mənə Quran oxu» dedi. Mən: «Ya Rəsulullah! Quran sizə nazil olduğu zaman mən sizə Quran oxuyacağam?» dedi. Peyğəmbər: «Mən onu başqasından dinləməyi daha çox sevirəm» deyə buyurdu. Mən də ən-Nisa surəsini oxumağa başladım. Nəhayət: ***«Hər ümmətdən şahid gətirəcəyimiz və səni də onlara şahid təyin edəcəyimiz zaman** (kafirlərin) **halları nə cür olacaqdır».** *(ən-Nisa 41).* Ayəsinə çatmışdım ki, Peyğəmbər: «Bu qədər kifayətdi» deyə buyurdu. Mən ona tərəf çöndükdə gördüm ki, gözləri yaşla dolub . Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Quran oxuyun və ona uyğun əməl edin. Lakin onun vasitəsilə yeməyin» . Ömər - *radıyallahu anhu* – deyir ki, Quranı beş ayə, beş ayə öyrənin. Çünki Cəbrail – *əlehissəlam* – Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ə beş ayə, beş ayə nazil etmişdir . Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Quranı məharətlə oxuyan şəxs ən yüksək dərəcəli və xeyirli mələklərlə birlikdədir» . Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şübhəsiz ki, bu Quran Allahın bir ziyafətidir. Onun ziyafətini gücünüz çatdığı qədər öyrənin. Doğurdan da bu Quran Allahın ipidir. O, aydın bir nurdur, fayda verici şəfadır. Ona möhkəm-möhkəm sarılan qorunar, ona əsaslanan xilas olar. O, hər hansı bir şəkildə təhrif edilə bilməz ki, sonradan doğruldulmalı olsun. Yolundan sapmaz ki, düz yola gətirsin. Onun heyrətamiz xüsusiyyətləri bitib-tükənməz. Çox oxunduğuna görə əskilib köhnəlməz. Onu oxuyun, çünki Allah onu oxumağınızdan ötrü hər bir hərfinə görə sizə on xeyirli mükafat verər…» . Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bunu da bilin ki, lap yaxında bir sıra fitnələr baş verəcəkdir». Ordakılardan: «Bu fitnələrdən necə xilas olmaq olar» deyə soruşdular. Peyğəmbər: «Allahın kitabı ilə. Allahın kitabında sizdən əvvəlkilərin biliyi, sizdən sonrakıların xəbəri, aranızdakı (anlaşılmazlıqların) hökmü vardır. O, haqqı batildən ayıran, o, əyləncə də deyildir. O, elə bir kitabdır ki, bir kimsə yekəbaşlığından onu tərk edərsə Allah onun belini qırar. Kim ki, doğru yolu ondan başqa yerdə axtararsa Allah onu azdırar. O, Allahın möhkəm ipidir. O, hikməti sonsuz olan zikrdir. O, doğru yoldur. O, istəklərin azdıra bilmədiyi və dillərin qarışdıra bilmədiyi bir kitabdır. Alimlər ondan doymazlar. Çox oxunduğuna görə köhnəlməz (bezdirməz). Heyrətamiz xüsusiyyətləri bitib tükənməz. Onu eşitdikləri vaxt cinlərin: ***«…Biz çox qəribə bir Quran eşitdik…».*** *(əl-Cinn 1)* deməkdən özlərini saxlaya bilmədikləri bir sözdür. O, elə bir kitabdır ki, onun əsasında danışan doğru danışar, ona əsaslanaraq hökm verən ədalətli olar və ona layiqincə əməl edən savab qazanar. O, kitabı oxumağa dəvət edən doğru yola yönəldir» . Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər kim Quranı oxuyub öyrənərsə və ona layiqincə əməl edərsə Qiyamət günü onun ata-anasının başına günəş işığına bənzər bir tac qoyularaq, dünyadan da qiymətli bir paltar ona geyindirilər». Valideyinləri: «Biz hansı səbəbdən geyindirildik?» deyərlər. Onlara: «Övladınızın Qurana bağlılığına

[764] Əbu Davud 1471.
[765] Buxari 5050, Müslim 800.
[766] Səhih Silsilə 1/522 hədis 260.
[767] Beyhəqi «Şubul İman».
[768] Buxari, Müslim.
[769] Həkim, əz-Zəhəbi zəif.
[770] Tirmizi, əl-Albani hədisin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən deyil, Əli b. Əbu Talib - *radıyallahu anhu* – tərəfindən deyilmiş olduğunu bildirməkdədir.

görə» deyiləcəkdir . Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şübhəsiz ki, Allahın insanlar arasında öz adamları vardır». «Onlar kimlərdir ey Allahın Rəsulu?» deyə soruşdular. Peyğəmbər: «Onlar Quran əhlidir, onlar Allah əhli və Allahın seçdiyi şəxslərdir» deyə buyurdu . Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Quran oxuyun, ona əməl edin, ondan uzaq düşməyin. Onun həddini aşmayın. Onu yemək vasitəsinə çevirməyin. Onun vasitəsilə mallarınızı çoxaltmağa cəhd etməyin» . Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Quran oxuyun və onun vasitəsilə insanlardan bir şey istəyən qruplar peyda olmamışdan əvvəl Quranı oxuyun və onun vasitəsilə Allahdan istədiklərinizi diləyin» . Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Quranı aşkara (insanların eşidə biləcəkləri şəkildə) oxuyan kimsə aşkara sədəqə verən kimidir. Gizlicə oxuyan isə gizlicə sədəqə verən kimidir» . Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Quranı səsinizlə gözəlləşdirin. Gözəl səs Quranın gözəlliyini daha da artırır» . İbn Abbas - *radıyallahu anhu* – dan bir gecəyə bütün Quranı oxumaq barədə sual verirlər. O: «Bir gecədə bir surə oxumaq bütün Quranı oxumaqdan əfzəldir». Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim Quranı üç gündən az bir müddətə oxuyarsa nə dediyini başa düşməz (Başqa rəvayətdə: Oxumaq istəyən ayda bir dəfə, daha tez oxuyan iyirmi gündə bir dəfə, yeddi gündə bir dəfə, beş gündə bir dəfə və üç gündə bir dəfə)» . Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in vaxtında Hişam b. Həkim Furqan surəsini oxuyarkən eşitdim. Oxumağına qulaq asdım. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in mənə öyrətdiyindən başqa şəkildə oxuyurdu. Harda isə namaz vaxtı üstünə atılacaqdım. Lakin salam verənə qədər səbr etdim. Namazı bitirdikdən sonra yaxasından yapışaraq: «Səndən eşitdiyim bu surənin bu cür oxunuşunu sənə kim öyrədib» dedim. O: «Mənə bu surənin oxunuşunu Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – öyrədib» dedi. Ömər: «Sən yalan deyirsən. Çünki Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – bu surənin oxunuşunu mənə sən oxuduğun kimi öyrətməyibdir» dedim və onu da götürüb Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in yanına getdik. Mən: «Ya Rəsulullah! Mən bu (insanın) Furqan surəsini sən mənə öyrətdiyindən başqa bir şəkildə oxuduğunu eşitdim» dedim. Peyğəmbər: «Burax onu. Sən isə oxu ey Hişam» deyə buyurdu. O, surəni mən eşitdiyim tərzdə oxudu. Peyğəmbər: «Bu şəkildə də mənə nazil oldu» deyə buyurdu. Sonra mənə tərəf çevrilərək: «İndi sən oxu ey Ömər!». Mən də Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in bu surəni mənə öyrətdiyi şəkildə oxudum». Peyğəmbər: «Bu şəkildə də mənə nazil olmuşdur və bu Quranı yeddi qiraət üzərə oxumaq olar. Sizə yüngül gələn qiraət üzərə oxuyun» deyə buyurdu . İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizdən birinizin – mən bu qədər, bu qədər ayə unutdum – deməsi nə pis bir şeydir. Həqiqətdə isə o, unutmadı, ona unutduruldu. Sizlər daima Quranı oxuyub əzbərləməyə çalışın. Çünki onun insanların qəlblərindən getməsi dəvələrin qaçıb getməsindən daha tezdir» .

---

[771] əl-Albani «Səhih Tərğib» 1434.
[772] əl-Albani «Səhih İbn Məcə» 214.
[773] İmam Əhməd.
[774] İmam Əhməd.
[775] Əbu Davud, Hakim.
[776] Buxari, Əbu Davud, Hakim.
[777] Buxari, Müslim., Əbu Davud.
[778] Buxari 4992.
[779] Buxari 5031.

# KİTABLARA İMANIN FAYDALARI

1. Bu kitabların həqiqətən Allahdan endirilmiş olduqlarına iman etmək.
2. Adlarını bildiklərimiz kitablara adla iman etmək, adlarını bilmədiyimiz kitablara da icma ilə iman etmək.
3. Bu kitabların səhih olan xəbərlərini təsdiq etmək. Quranın xəbərlərini və əvvəlki kitabların dəyişdirilməyən və ya təhrif edilməyən xəbərlərini qəbul etmək.
4. Nəsx olunmamış hökmləriylə əməl edib, hikmətini istər qavramış olsun, istər qavramamış olsun bunlara təslimiyyət göstərmək.
5. Hər bir qövmə onları hidayətə yönəltmək üçün kitab endirmiş olduğu üçün Allahın nemətini bilmək.
6. Allahın şəriətindəki hikmətləri bilmək. Çünki Allah hər bir qövmə onların durumlarına uyğun şəriətlər göndərmişdir.
7. Buna görə Allahın bu nemətinə şükr etmək.

# PEYĞƏMBƏRLƏRƏ İMAN

***Rəsul*** – Peyğəmbər kəlməsi ***Rəsulun*** – göndərilən deməkdir. Bu da bir işi təbliğ etmək üçün göndərilən kimsə mənasına gəlir. Burada qəsd Allahın insanlar arasında şəriət vəhy edib, o şəriəti təbliğ etməsini əmr etdiyi kimsədir.

Göndərilmiş bütün Peyğəmbərlər yalnız kişilərdən ibarət olub. ***«Biz səndən əvvəl də özlərinə vəhy etdiyimiz ancaq kişi peyğəmbərlər göndərmişdik».*** *(ən-Nəhl 43).*

Rəsulların ilki Nuh – *əlehissəlam* -, sonuncusu da Muhəmməd – *sallallahu aleyhi və sələm* – dir. ***«Biz Nuha və ondan sonrakı Peyğəmbərlərə vəhy göndərdiyimiz kimi sənə də vəhy göndərdik».*** *(ən-Nisa 163).* Ənəs b. Məlik - *radıyallahu anhu* – nun rəvayət etdiyi şəfaət hədisində Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – insanların Adəm – *əlehissəlam* – ın yanına şəfaət etmək üçün getmələri, o da: «Nuh – *əlehissəlam* – ın yanına gedin o, Allahın göndərdiyi ilk rəsuldur» - deməsi də buna dəlildir. Muhəmməd – *sallallahu aleyhi və səlləm* – haqqında: ***«Məhəmməd aranızdakı kişilərdən heç birinin atası deyildir. Lakin o, Allahın Rəsulu və Peyğəmbərlərin sonuncusudur».*** *(əl-Əhzab 40).* O, halda Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən sonra heç bir peyğəmbər gəlməyəcəkdir. Məryəm oğlu İsa, axır zamanda enəcəkdir və o, bir rəsuldur deyiləcək olursa cavabımız belədir: Bu doğrudur. Lakin o, özündən əvvəlki şəriətləri təzələyən bir Rəsul olaraq enməyəcəkdir. O, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in şəriəti ilə hökm edən birisi olaraq enəcəkdir. ***«O, vaxtı yadınıza salın ki, Allah peyğəmbərlərdən sizə verdiyim Kitab və hikmətdən sonra sizdə olanı təsdiq edən bir Peyğəmbər gəldikdə ona mütləq inanıb yardım edəcəksiniz deyə əhd almış və onlara: «Bunu təsdiq edib ağır olan əhdimi qəbul etdinizmi?» demişdi. Onlar da: «Təsdiq etdik!» deyə cavabn vermişdilər. Allah: «Elə isə şahid olun! Mən də sizinlə bərabər şahidlərdənəm deyə buyurmuşdu».*** *(Ali İmran 81).* Çünki istər İsa – *əlehissəlam* –, istərsə digər Peyğəmbərlərə düşən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə iman etmək, ona uymaq və ona yardımçı olmaqdır.

Elm əhlinin söylədiklərinə görə Rəsul (Elçi) ilə Nəbi (Peyğəmbər) arasında fərq budur: «***Nəbi*** **–** şəriət vəhy edilməklə birlikdə o, şəriəti təbliğ etmə əmri verilməyəndir.

---

[780] Buxari.

***Rəsul*** **–** Allahın şəriət vəhy etdiyi və onu təbliğ etməsini, gərəyincə əməl etməsini əmr etdiyi kimsədir. Buna görə də hər rəsul bir nəbidir, lakin hər nəbi rəsul deyildir».

Əhli Sünnə vəl Cəmaat Allahın qullarını müjdələyən, insanları hidayətə yönəldən və zülmətdən nura çıxartmaq üçün haqq dinə dəvət edən, rəsullar, peyğəmbərlər göndərildiyinə inanırlar. Onlardan birini inkar edən Allahı və bütün Peyğəmbərləri inkar etmiş olur. ***«Allahı və Peyğəmbərlərini inkar edənlər, Allahı Peyğəmbərindən ayırmaq istəyənlər: «Biz peyğəmbrlərdən bəzisinə inanır, bəzilərinə isə inanmırıq» deyənlər və bunun arasında bir yol tapmaq istəyənlər bütün bunlar həqiqətən kafirlərdir. Biz kafirlərdən ötrü rüsvayedici əzab hazırlamışıq. Lakin Allaha və Peyğəmbərinə iman gətirən və onların heç birini digərindən ayırmayan şəxslərə Allah öz mükafatlarını verəcəkdir. Şübhəsiz ki, Allah bağışlayan və rəhm edəndir».*** *(ən-Nisa 150-152).*

***Nə Üçün Allah Peyğəmbərlər Göndərib?***

**1.** Hər hansı bir qövmə Peyğəmbər gəlmədiyi üçün Allah ora Peyğəmbər göndərib.

**2.** Ola bilər ki, bir qövmə Peyğəmbər göndərilib, lakin gətirdiyi şəriət dəyişildiyinə görə yeni Peyğəmbər göndərilib.

**3.** Hər hansı bir qövmə Peyğəmbər göndərilib, şəriət olduğu kimi qalıb, lakin sonrakı zamana uyğun olsun deyə, yeni hökmlərə ehtiyac olduğu üçün Peyğəmbər göndərilib.

**4.** Hər hansı bir Peyğəmbərin dediklərini təsdiq etmək üçün, kömək olsun deyə Peyğəmbər göndərilib.

Allah hər ümmətə onların içərsindən onları bir və tək olan Allaha ibadət etməyə və ondan başqa ibadət olunan bütün varlılıqları rəd və inkar etməyə çağıran Peyğəmbərlər göndərdiyinə inanmaqdır. Allah hər ümmətə şəriət ilə bir Peyğəmbər göndərmədiyi və ya ondan əvvəlki Peyğəmbərlərin şəriətini yeniləmək (təzələmək) üçün vəhy etdiyi bir Peyğəmbər (nəbi) göndərilməmiş heç bir ümmət yoxdur. ***Biz hər ümmətə: «Allaha ibadət edin və tağutdan çəkinin» deyə Peyğəmbər göndərmişdik».*** *(ən-Nəhl 36).* ***«Elə bir ümmət yoxdur ki, onun içindən qorxudan bir peyğəmbər gəlib getməsin».*** *(Fatir 24).*

Onların çağırışları ümmətləri şirk və bütpərəstlikdən qurtarmaq, insanları çirkin və fahiş işlərdən çəkindirmək üçündür. Onlar risalətlərini təbliğ etdilər, üzərilərindəki əmanəti əskiksiz yerinə yetirdilər, ümmət-lərinə səmimiyyətlə öyüd-nəsihət verdilər. Allah yolunda layiqli cihad etdilər. Rəbləri tərəfindən dəstəklənmiş oldular. ***«Allah mələklərdən elçilər seçdiyi kimi insanlardan da seçər».*** *(əl-Həcc 75).*

Heç bir şeyi gizlətməyib, hər hansı bir dəyişiklik etmədiklərinə, özlərindən ora nə bir hərf artırıb, nə də bir hərf əskiltmədiklərinə inanmaqdır. ***«Peyğəmbərlərin vəzifəsi isə yalnız açıq-aşkar bir təbliğdir».*** *(ən-Nəhl 35).*

Allah o, şərəfli Rəsulların göndərməsində hikməti: ***«Biz Peyğəmbərləri müjdə gətirən və əzabla qorxudan kimi göndərdik ki, daha insanlar üçün Peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın. Allah yenilməz qüvvət və bilik sahibidir».*** *(ən-Nisa 165).*

Rəsullar da yaradılmış insanlardır. Rububiyyət və Uluhiyyət xüsusiyyətlərindən heç birisinə sahib deyillər. Onlar Allahın istədiyindən artıq nə özlərinə, nə də hər hansı bir kimsəyə nə fayda, nə də zərər verməк gücünə malikdirlər. ***De ki: «Mən sizə demirəm ki, məim yanımda Allahın xəzinələri vardır. Mən qeybi də bilmirəm və sizə də demirəm ki, mən mələyəm. Mən özümə gələn vəhyə tabe oluram». De ki: «Kor***

***görənlə bir olurmu? Məgər düşünmürsünüz!».*** *(əl-Ənam 50).* ***«Peyğəmbərləri onlara cavab olaraq demişdilər: «Biz də sizin kimi adi bir insanıq. Lakin Allah öz bəndələrindən dilədiyinə nemət bəxş edər. Allahın izni olmadan biz sizə heç bir dəlil gətirə bilmərik».*** *(İbrahim 11).* ***«De ki: «Mən də sizin kimi ancaq bir insanam. Mənə vəhy olunur ki, sizin tanrınız yalnız tək olan Allahdır. Kim Rəbbi ilə qarşılaşacağına ümüd bəsləyirsə yaxşı iş görsün və rəbbinə etdiyi ibadətdə heç kəsi şərik qoşmasın»*** *(Kəhf 110).*

Onlara əmr edilən şeylərə uyan bir əmirdirlər. ***De ki: «Mən sizə nə bir zərər, nə də bir xeyir vermək qüdrətinə malik deyiləm!» De ki: «Məni Allahdan heç kəs qurtara bilməz və mən ondan başqa heç bir sığınacaq tapa bilmərəm!»*** *(əl-Cinn 21-22).* ***De ki: «Mən Allahın istədiyindən başqa özümə nə bir xeyir, nə də bir zərər verə bilərəm. Əgər qeybi bilsəydim, sözsüz ki,*** *(özüm üçün)* ***daha çox xeyir tədarük edərdim və mənə pislik də toxunmazdı. Mən iman gətirən bir tayfanı qorxudan və müjdələyənəm»*** *(əl-Əraf 188).*

Xəstəlik, ölüm, yemək və içmək kimi şeylərə ehtiyac duyduqları və s. buna bənzər özəlliklər onlar haqqında da söz edilməkdədir. ***«Məni yaradan və məni doğru yola yönəldən Odur! Məni yedirdən də içirdəndə Odur! Xəstələndiyim zaman mənə yalnız O şəfa verir. Məni öldürəcək sonra diriIdəcək də Odur və Qiyamət günü xətamı bağışlayacağına ümüd etdiyim də Odur!».*** *(əş-Şuəra 78-82).* Həmçinin Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Əgər sənə desələr Muhəmməd sabah nə olacağını bilir, inanma»[781]. İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mən ancaq sizin kimi bir insanam. Unutduğunuz kimi unuduram. Unutduğum zaman yadıma salın»[782].

Əhli Sünnə əqidəsinə görə Peyğəmbərlər məsumdurlar (yəni onlar: Şirk. Küfr və s. kimi böyük günahlardan uzaqdırlar). Lakin onların kiçik xətaları olmuşdur: Məs: ***Adəm*** – *əlehissəlam* – ın Allahın qadağan etdiyi ağacdan yeməsi: ***«****(Adəm və Həvva)* ***Ey Rəbbimiz! Biz özümüzə zülm etdik. Əgər bizi bağışlamasan və mərhəmət etməsən. Biz şübhəsiz ki, ziyana uğrayanlardan olarıq».*** *(əl-Əhqaf 23).* (Buxari, Müslim şəfaət hədisi), ***Nuh*** – *əlehissəlam* – ın öz oğlu üçün bağışlanma diləməsi (Buxari, Müslim şəfaət hədisi), ***Ibrahim*** – *əlehissəlam* – ın öz atası üçün bağışlanma diləməsi və üç dəfə yalan danışması (Buxari, Müslim şəfaət hədisi), ***Musa*** – *əlehissəlam* – ın Qibtini öldürməsi (əl-Qəsəs 18-ci ayəsinə bax), ***Muhəmməd***[783] – *sallallahu aleyhi və səlləm* – in yanına gələn kor Ummu Məktub - *radıyallahu anhu* – dan üzünü çevirməsi (Əbəsə surəsinə bax), namaz rükətlərinin sayının azaldıb, çoxaltması. Sübh namazının yatıb qalmaları (Buxari, Müslim namaz bölümü, səhv səcdələri), balı özünə haram etdiyinə (başqa rəvayətdə: Mariya - *radıyallahu anhə* – nin yanına getmədiyi üçün ət-Təhrim 1-ci ayəsinə bax). Kiçik xətalar Peyğəmbərlər tərəfindən olub və bu əməldən sonra dərhal tövbə ediblər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in bu xətaları etməsində bir hikmət vardır. Çünki bu xətalardan dərhal sonra nə etmək lazım olduğunu o, ümmətinə bildirmişdir. Artıq bununla biz bu kimi xətalardan sonra nə edəcəyimizi bilirik.

---

[781] Buxari.
[782] Buxari, Müslim.
[783] ***Muhəmməd*** – adı Qurani Kərimdə dörd dəfə çəkilibdir: Ali İmran 144, əl-Əhzəb 40, əl-Fəth 29, Muhəmməd 2.

Allah onları insanlar arasında ən şərəfli, hörmətli, olduqlarını qeyd etməklə yanaşı onların bütün yaradılmışlar kimi Allahın qulu olduqlarını da qeyd edir. ***«Həqiqətən Nuh çox şükr edən qul idi».*** *(əl-İsra 4).* ***«Aləmləri qorxutmaq üçün haqqı batildən ayıran Quranı öz quluna*** *(Muhəmmədə)* ***nazil edən Allah nə qədər uca, nə qədər uludur».*** *(əl-Furqan 1).* ***«O*** *(Məryəm oğlu İsa)* ***ancaq nemət verdiyimiz və İsrail oğullarına ibrət dərsi etdiyimiz bir quldur».*** *(əz-Zuxruf 59).*

Bütün bu göndərilən Peyğəmbərlərin məqsədləri bir olub. İnsanları Allaha ibadət etməyə çağırmaq. ***Həqiqətən biz Nuhu öz qövmünə Peyğəmbər göndərdik. O, belə dedi: «Ey qövmüm! Allaha ibadət edin. Sizin Ondan başqa*** *(ibadət edəcək)* ***heç bir ilahınız yoxdur. Məgər qorxmursunuz».*** *(əl-Muminun 23).* ***Ad tayfasına da qardaşları Hudu Peyğəmbər göndərdik. O, dedi: «Ey camaatım! Allaha ibadət edin. Sizin Ondan başqa heç bir tanrınız yoxdur. Siz isə yalnız iftiraçısınız».*** *(Hud 50).* ***Səmud tayfasına da öz qardaşları Salehi Peyğəmbər göndərdik. O, dedi: «Ey camaatım! Allaha ibadət edin. Sizin Ondan başqa heç bir tanrınız yoxdur».*** *(Hud 61).* ***Mədyən əhlinə də qardaşları Şüeybi Peyğəmbər göndərdik. O, dedi: «Ey qövmüm! Allaha ibadət edin. Sizin Ondan başqa heç bir tanrınız yoxdur».*** *(Hud 84).* ***Yadına sal ki, bir zaman İbrahim atasına və qövmünə demişdi: «Mən sizin ibadət etdiklərinizdən tamamilə uzağam. Yalnız məni yoxdan yaradan Allahdan başqa! Şübhəsiz ki, O məni doğru yola müvəffəq edəcəkdir».*** *(əz-Zuxruf 26-27).*

Allah bir çox Rəsul və Peyğəmbər göndərmişdi. Bəzilərini adı Qurani Kərimdə və Sünnə də bizə gəlib çatmış, bəzilərinin də adları bildirilməmişdir. ***«Biz Peyğəmbərlər göndərdik. Onların bəzisinin əhvalatını bundan əvvəl sənə danışdıq, bəzisinin əhvalatını isə söyləmədik!».*** *(ən-Nisa 164).*

Qurani Kərimdə adları zikr olunan **25** Rəsul və Peyğəmbər vardır. ***«Bu bizim İbrahimə*** *(1)* ***öz tayfasına qarşı verdiyimiz dəlildir. Biz istədiyimiz şəxsi mərtəbə-mərtəbə yüksəldirik. Şübhəsiz ki, Rəbbin hikmət və elm sahibidir. Biz İshaqı*** *(2)* ***və Yəqubu*** *(3)* ***ona əta etdik. Onların hər birini hidayətə çatdırdıq. Bundan əvvəl Nuhu*** *(4)* ***və onun nəslindən olan Davudu*** *(5)*, ***Süleymanı*** *(6)*, ***Əyyubu*** *(7)*, ***Yusifi*** *(8)*, ***Musanı*** *(9)* ***və Harunu*** *(10)* ***da hidayətə qovuşdurduq. Biz yaxşı iş görənləri belə mükafatlandırırıq. Zəkəriyyəni*** *(11)*, ***İsanı*** *(12)*, ***İlyası*** *(13)* ***da hidayətə çatdırdıq. Onların hamısı əməlisalehlərdən idi. Biz həmçinin İsmaili*** *(14)*, ***Əlyəsəi*** *(15)*, ***Yunusu*** *(16)* ***və Lutu*** *(17)* ***da hidayətə qovuşdurduq və onları insanlardan üstün etdik».*** *(əl-Ənam 83-86).* ***«İdrisi*** *(18)* ***və Zulkifli*** *(19)* ***də yad et».*** *(əl-Ənbiya 85).* ***«Ad tayfasına qardaşları Hudu*** *(20)* ***göndərdik».*** *(əl-Əraf 65).* ***«Səmud*** *(tayfasına)* ***qardaşları Salehi*** *(21)* ***göndərdik».*** *(əl-Əraf 73).* ***«Mədyən tayfasına da Şüeybi*** *(22)* ***göndərdik».*** *(əl-Əraf 85). Həmçinin Adəm, Yəhya və Muhəmməd (hamısına Allahın salat və salamı olsun!)* . ***«Biz səndən əvvəl də Peyğəmbərlər göndərmişdik. Onların kimisi haqqında sənə xəbər vermiş, kimisi haqqında xəbər verməmişik».*** *(əl-Mumin 78).*

Onların içərsində ən fəzilətliləri Ulul Azim deyə adlanan beş Peyğəmbərdir. ***Xatırla ki, biz bir zaman Peyğəmbərlərdən əhd almışdıq: «Səndən də, Nuhdan da, İbrahimdən də, Musadan da, Məryam oğlu İsadan da!».*** *(əl-Əhzab 7).*

---

[784] Bu Peyğəmbərlərdən üçü övliya sayılır. ***Loğman, Üzeyr, Zülqərneyn*** - *Allahın salat və salamı onların üzərinə olsun!* -. O, ki qaldı Peyğəmbərlərin ümumi sayına ki, nə qədər olublar bu haqda müəyyən bir rəqəm yoxdur. Hədisdə gəlir ki, onların sayı **324** mindir və bunlardan **313**-ü Rəsuldur. Lakin bu hədisin sənədində yalançı ravilər olduğu üçün hədis zəifdir. Bax: «Zədul Məad» 1 cild, Şureyb Arnaudun təhqiqi ilə.

Allah Peyğəmbərləri bir-birindən üstün etmişdi. (Ya Muhəmməd!) ***«Biz Peyğəmbərlərin bəzisini digərindən üstün etdik. Allah bunlardan bəzisi ilə danışmış, bəzisinin isə dərəcələrini yüksəltmişdir».*** *(əl-Bəqərə 253).* ***«Biz Peyğəmbərlərin bəzisini digərlərindən üstün etdik».*** *(əl-İsra 55).*

Ulul Azim deyə bilinən Peyğəmbərlərin ən fəzilətlisi isə İslamın Peyğəmbəri, Peyğəmbərlərin və Rəsulların sonuncusu, aləmlərin Rəbbinin son elçisi Abdullah oğlu Muhəmməddir. ***«Lakin o, Allahın Rəsulu və Peyğəmbərlərin sonuncusudur».*** *(əl-Əhzab 40).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əli - *radıyallahu anhu* – buyurur: «Sənin mənə görə durumun Harunun Musaya görə durumu kimi olmasına razı deyilsən? Lakin məndən sonra heç bir Peyğəmbər gəlməyəcəkdir» .

## PEYĞƏMBƏRİMİZ MUHƏMMƏD
## - Sallallahu Aleyhi Və Alihi Və Səlləm –

Muhəmməd – *sallallahu aleyhi və səlləm* – Peyğəmbərlərin (nəbilərin) və Rəsulların sonuncusudur. Bütün insanlara göndərilmiş rəsuldur. O, Allahın bir quludur, ona ibadət edilməz, o bütün yaradılmışların ən xeyirlisi, ən fəzilətlisidir. Allah dərgahında ən dəyərlidir, dərəcəsi ən yüksək və Allaha ən yaxın olandır. O, haqqla, hidayətlə insanlara və cinlərə göndərilmiş bir peyğəmbərdir. Ona kitabını endirmiş, dininin əmini etmiş, risalətini təbliğ etməkdə onu seçmişdi. Bu risaləti təbliğ etməkdə onu səhf etməkdən və xəta etməkdən qorumuşdur. Onun risalətinə iman gətirib, nübuvətinə şəhadət gətirməyincə heç bir qulun imanı səhih olmaz. Ona itaət edən Cənnətə, ona qarşı çıxan isə Cəhənnəmə girər.

Peyğəmbərimiz – *sallallahu aleyhi və səlləm* – i bilmək özündə bir neçə xüsusiyyətləri əhatə edir.

**1.** ***Peyğəmbərin – Sallallahu Aleyhi Və Səlləm – İn Nəsəbini Bilmək*:**

Onun nəsəbi yer üzünün ən üstünüdür. Şərəf baxımından nəsəbi zirvədədir. Herakl Əbu Sufyan - *radıyallahu anhu* – dan Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in nəsəbini soruşaraq: «Onun nəsəbi aranızda necədir?». Əbu Sufyan: «O, bizim içimizdə yüksək bir nəsəbə sahibdir» deyə cavab vermişdir. Herakl: «Mən sənə onun nəsəbindən soruşdum. Sən də onun sizin içinizdə yüksək bir nəsəbə sahib olduğunu söylədin. Həqiqətən də Peyğəmbərlər öz qövmləri arasında yüksək bir nəsəbə sahib olaraq göndərilirlər» dedi . Həmçinin də Peyğəmbərlər haqqında keçən rəvayətlərdə də bu öz təsdiqini tapır. Məs: Şueyb – *əlehissəlam* – ın qövmü: ***«Əgər əşirətin olmasaydı səni daşqalaq edərdik».*** *(Hud 91).* İbn Haldun Bəğavi – *rahmətullahi aleyhi* – deyir ki: «Peyğəmbərliyin əlamətlərindən biri də qövmləri içərisində şərəfli bir ailəyə mənsub olmalarıdır». ***Nəsəbi:*** Muhəmməd b. Abdullah b. AbdulMuttalib (əsl adı: Şeybətul Həmd) b. Haşim (əsl adı: Amr) b. AbdiMənaf (əsl adı: Muğirə) b. Kusay (əsl adı: Zeyd) b. Kilab b. Murrə b. Kəb b. Luey b. Ğalib b. Fihr b. Məlik b. Nadr b. Kinanə b. Huzeymə b. Mudrikə b. İlyas b. Mudar b. Nizar b. Məad b. Adnan. Adnan Allahın Peyğəmbəri İbrahim – *əlehissəlam* – ın oğlu İsmail – *əlehissəlam* – ın nəslindəndir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şübhəsiz ki, Allah İsmail oğullarını seçmişdir. İsmail oğullarından da Kinanəni, Kinanədən də Qureyşi,

---
[785] Buxari, Müslim.
[786] Buxari.

Qureyşdən də Haşim oğullarını, Haşim oğullarından da Məni seçmişdir» . İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki, İbrahim – *əlehissəlam* – ın nəslindən iki böyük uşaq dünyaya gəlmişdir. Birincisi Həcərdən dünyaya gələn İsmail – *əlehissəlam* –, digəri də Saradan dünyaya gələn İshaq – *əlehissəlam* – dır. İshaq – *əlehissəlam* – ın nəslindən də Yaqub – *əlehissəlam* – dünyaya gəldi. Allah: ***«…Bundan sonra biz onu İshaqla, İshaqın ardıyca Yəqubla müjdələdik».*** *(Hud 71).* Onun nəslindən çox Peyğəmbər gəlmişdir. İsrail oğullarında gələn Peyğəmbərlər Məryəm oğlu İsa – *əlehissəlam* – ilə sona çatmışdır. İsmail – *əlehissəlam* – a gəlincə isə ərəblər onun soyundandırlar. Onun soyundan Peyğəmbər olaraq sadəcə Peyğəmbərlərin sonuncusu, seyyidi Muhəmməd b. Abdullah b AbdullMuttalib b. Haşim əl-Qureyşidir . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mən atam İbrahimin duası və İsanın müjdəsiyəm. Anam şam saraylarını işıqlandıran bir nurun çıxdığını gördü: ***«Ey Rəbbimiz! Onların içərisindən özlərinə elə bir Peyğəmbər göndər ki, Sənin ayələrini onlara oxusun, kitabı və hikməti onlara öyrətsin, onları təmizləsin! Həqiqətən*** *(Sən)* ***yenilməz qüvvət və hikmət sahibisən».*** *(əl-Bəqərə 129).* ***«Onu da xatırla ki, bir vaxt Məryəm oğlu İsa belə demişdir: «Ey İsrail oğulları! Həqiqətən mən özümdən əvvəl nazil olmuş Tövratı təsdiq edən və məndən sonra gələcək Əhməd adlı bir Peyğəmbərlə*** *(sizə)* ***müjdə verən Allahın elçisiyəm!».*** *(əs-Səff 6)* .

**2. *Peyğəmbərin – Sallallahu Aleyhi Və Səlləm – İn Yaşını, Doğulduğu Yeri, Hicrət Etdiyi Yeri Bilmək:***

Doğulduğu yer Məkkədir. Məkkədə Hişam oğulları məhəlləsində Rəbiul-Əvvəl ayının **9**-zu və ya **12**-də birinci günü səhər, **571**-ci ildə (Fil ilində) dünyaya gəlmişdir (Miladi tarixi ilə **22** Aprel). Məkkədə **53** il yaşadıqdan sonra Mədinəyə hicrət etmiş, orada da **10** il yaşamışdır. Hicrətin **11**-ci ilində, Rəbiul-Əvvəl ayının **12**-i, birinci günü, əsr vaxtına yaxın **63** yaşında dünyasını dəyişmişdir. Ənəs b. Məlik - *radıyallahu anhu* – deyir: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – **63** yaşında ikən dünyasını dəyişdi» . İbn Abbas - *radıyallahu anhu* – deyir: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Məkkədə **13** il, Mədinədə isə **10** il qaldıqdan sonra **63** yaşında dünyasını dəyişdi» . Onu dünyaya gətirən (doğuşda kömək edən) Abdurrahman b. Auf - *radıyallahu anhu* – nun anası Amrın qızı Şifa olmuşdur. Doğumunun yeddinci günündə sünnət edilmişdir. Bu haqda üç görüş vardır: Bəziləri qeyd edirlər ki, sünnətli doğulmuşdur. Uydurma bir hədisdə rəvayət edirlər. Bu iddia ilə bağlı doğru bir rəvayət yoxdur. Bəziləri də qeyd edirlər ki, süd anasının yanında Mələklərin qəlbini açdıqları gün sünnət edildi, bəziləri də deyirlər ki, doğumunun **7**-ci günü babası AbdilMuttalib sünnət etdi və ən doğru rəy də elə budur. Ona ilk xidmət edən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in atası Abdullahın xidmətçisi Ummu Əymən olmuşdur. Ummu Əymən müsəlman olana qədər yaşamış, hicrət etmiş və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən **5** və ya **6** ay sonra vəfat etmişdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onu Zeyd b. Həris - *radıyallahu anhu* – ilə evləndirmişdir. Usamə b. Zeyd - *radıyallahu anhu* – nun anasıdır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Ummu Əymən üçün: «***Ummu Əymən Ummi Badə Ummi*** – Ummu Eymən anamdan sonra

---

[787] Müslim.
[788] İbn Kəsir «Qısasul Ənbiya» 175.
[789] Əhməd 5/262, Həkim 2/600.
[790] Müslim.
[791] Müslim.

anamdır». Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Mədinəyə gələndə bütün şəhər sevinirdi. O, öldüyü gün isə bütün şəhər zülmətə qərq olmuşdu . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dünyasını dəyişdikdən sonra Əbu Bəkr və Ömər - *radıyallahu anhum* – onun süd anasını ziyarət etmək qərarına gəlirlər. Qoca qadın ilə görüşdükdə onun ağladığını görüb dedilər: «Nəyə ağlayırsan? Allah Rəsulu üçün Onun (Allahın) dərgahında daha yaxşıdır». Qoca qadın dedi: «Mən ona görə ağlayıram ki, artıq vəhylər gəlməyəcəkdir». Bu sözlər Əbu Bəkr və Ömər - *radıyallahu anhum* – da ağlamağa məcbur etdi .

Rəsulullahın atası AbdulMuttalib oğlu Abdullahdır. Məhəmmədin atası o, doğulmamışdan əvvəl, yoxsa sonra öldüyü haqqında bəzi rəylər vardır. Bu rəylərdən ən doğrusu: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in anasının bətnində ikən atasının öldüyüdür. İkinci rəyə görə, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – doğulduqdan **7** ay sonra ölmüşdür. Abdullah ticarət məqsədi ilə Şama gedib qayıtdıqda Mədinədə vəfat edir. ***Darul Nəbiyyatuz Zəhra*** deyilən yerdə dəfn edilir. Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, bir nəfər: «Ya Rəsulullah! Atam haradadır?» deyə soruşdu. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Cəhənnəmdə». Adam getmək istədikdə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – onu çağıraraq: «Heç şübhəsiz ki, mənim atamda, sənin atanda Cəhənnəmdədir» deyə buyurdu .

Anası Kilabın oğlu Zuhrənin oğlu AbdiMənafın oğlu Vəhbin qızı Əminədir. Kilab Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in nəsəbində **5**-ci babasıdır. Bu tərəfdən Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in atası və anası eyni kökdən olub ikisi də Kilabda birləşirlər. Anası Əminədən sonra onu ilk əmizdirən Əbu Ləhəbin köləsi Suveybədir. Ərəblərdə o, vaxtlar yeni doğulan uşaqları əmizdirmək üçün başqa bölgələrə göndərmək adəti vardı. Bunu uşaqların daha sağlam və güclü böyümələri üçün belə edirdilər. Suveybə öz oğlu olan Məsruqla bərabər onu bir aya yaxın əmizdirdi. Həmçinin də Hamda və Əbu Sələmə b. Abduləsəd əl-Mahzumiyi də əmizdirmişdir. Hər ikisi də Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in süd qardaşlarıdır. Həmçinin də Peyğəmbərin əmisi Həmzə - *radıyallahu anhu* – nu da əmizdirmişdir. Bundan sonra Məkkəyə Bəni Sad b. Bəkr b. Həvazin qəbiləsindən bir neçə süd əmizdirici qadınlar gəlir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu qadınlara süd verilməsi üçün təqdim edilir. Lakin yetim olduğuna görə onu götürən olmur. Buna baxmayaraq içərilərindən Əbu Suveybin qızı Həlimə əmizdirmək üçün uşaq qalmadığından əlacsızlıqdan onu götürür. Həlimənin əri Həris b. Abdiluzzadır. Hər ikisi də Sad b. Bəkr b. Həvazin qəbiləsindəndirlər. Uşaqları Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in süd qardaşlarıdırlar. Abdullah, Ənisə və Qudamə (Şeymə kimi də tanınır) Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yetişməsində böyük rolu olmuşdur. Həlimə həmçinin də Əbu Sufyan - *radıyallahu anhu* – nu da əmizdirmişdir. Həlimənin Məkkədə olduğu o, günlər qıtlıq və aclıq günləri idi. Dəvələri süd vermir, köksündə də süd azalmışdır. Lakin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – i öz yurduna götürdükdə Allahın izni ilə onlara bərəkət nazil olmuşdur. Qadın onu qucağına alıb əmizdirmək istədikdə köksünün südlə dolduğunu gördü. Dəvələri bol süd verməyə başladılar. Həlimə **2** ildən sonra onu süddən kəsir. Artıq böyümüş və güclənmişdi. Həlimə hər **6** aydan bir onu görmələri üçün anasının yanına

---

[792] Tirmizi, Şueyb əl-Arnaut səhih olduğunu qeyd edir.
[793] Müslim.
[794] Müslim 203, Əbu Davud 4718.

gətirirdi. Süttən kəsiləndən sonra onu anası Əminənin yanına gətirir. Peyğəmbər ilə gələn bərəkətdən son dərəcə sevinc içində olan Həlimə uşağın bir müddətdə yanında qalmasını xahiş edir. Əminə razı olur. Həlimə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – i alaraq sevinc içində öz yurduna dönür. İki il də daha süd anası Həlimə ilə bərabər qalır. Lakin sonra baş verən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in ***Şakki Sadr*** qəlbinin yarılması hadisəsi onları uşağı anasına qaytarılmasını məcbur edir. Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – uşaqlarla oynayarkən Cəbrail – *əleyhissəlam* – onun yanına gəldi. Onu götürərək yerə yıxdı və sinəsini yardı. Qəlbini çıxardı. Qəlbindən bir qan laxtasını çıxardıqdan sonra Peyğəmbərə: «Bu şeytanın səndən olan bir nəsibidir!» deyə ona göstərdi. Sonra qəlbini qızıldan bir qab içində Zəm-Zəm suyu ilə yudu. Daha sonra qəlbini yerinə qoydu. Onunla oynayan uşaqlar qaçaraq süd anasının yanına gəldilər və: «Muhəmməd öldürüldü!» dedilər. Onun yanına gəldilər. Rəngi soluq bir halda idi. Ənəs: «Mən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sinəsində o, izi görmüşdüm!» dedi . Bu hadisədən sonra Məkkəyə anasının yanına gətrilir və **2** il orada qaldıqdan sonra anası onu Mədinəyə qohumlarının, dayılarının və atasının qəbrinə götürür. Mədinədə bir ay qaldıqdan sonra geri qayıdırlar. Yolda anası xəstələnir və Məkkə ilə Mədinə arasında olan ***Əbva*** adlanan yerdə dünyasını dəyişir. Anası dünyasını dəyişəndə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – **7** yaşında idi.

Anasının ölümündən sonra onu öz himayəsinə babası AbdulMuttalib götürür. Ölənə qədər ona baxır. AbdulMuttalibin atası Haşim Şama ticarət məqsədi ilə çıxdıqda yolda Mədinə şəhərinə daxil olur. Orada Nəccar b. Adi qəbiləsindən Amr b. Zeydin evində müsafir olur. Amrın qızı Səlmanı görüb onunla evlənir. Bir müddət orada qaldıqdan sonra Səlmanı hamilə olaraq orada buraxaraq Şama getmək üçün yola çıxır. Səfəri əsnasında Fələstinin Qazzə bölgəsində vəfat edir. Sonra Səlma Mədinədə bir oğlan uşağı dünyaya gətirir. İsmini Şeybə olaraq adlandırır. Əmisi Muttalib qardaşı oğlunu görmək arzusu ilə Mədinəyə gəlir və orada Səlmanın razılığı ilə uşağı götürüb Məkkəyə gətirir. Məkkədə Muttalibi görənlər yanındakı kimdir? deyə soruşardılar. O, da göz dəyməsin deyə köləmdir – deyə cavab verərdi. Bundan sonra da insanlar onu AbdulMuttalib – Muttalibin köləsi deyə çağırmağa başladılar. AbdulMuttalib yuxusunda Zəm-Zəm quyusunun yeri göstərilir və oranı qazmaq əmr edilir. Oğlu Haris b. AbdulMuttaliblə birlikdə o, yeri tapıb qazır. AbdulMuttalib nəzir etmişdir ki, əgər həyatda **10** övladı olsa onlardan birini qurban kəsəcəkdir. Dilədiyi həyata keçdikdə (**13** oğlu olduqda) o, oğlanları arasında püşk atır. Püşk də hər dəfəsində Abdullaha düşür. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in atası Abdullah, AbdulMuttalibin oğulları arasında ən gözəli, ən sevimlisi və ən iffətlisi idi. Lakin qardaşları, Qureyşlilər onu bu işdən çəkindirirlər. Buna görə də AbdulMuttalib Abdullahın yerinə **100** dəvə qurban etməyi Allaha nəzir edir. Buna görə də Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – həm **2** qurban edilənin İsmail və Abdullah – həm də **2** fidyə verilənin oğludur. İsmail – *əlehissəlam* – ın yerinə **1** qoyun, Abdullahın yerinə isə **100** dəvə fəda edilmişdir. AbdulMuttalib öldükdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – **8** yaşında idi. **10** yaşında olduğu da söylənilir.

Babasından sonra əmisi Əbu Talibin yanında yaşamağa başlayır. **12** yaşında əmisi ilə birlikdə Şama ticarət məqsədi ilə gedir. **9** yaşında olduğu da söylənilir. Bu səfərində

---

[795] Buxari, Müslim.

rahib Bahira ilə qarşılaşır. Rahib, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in əlindən tutaraq bu aləmlərin Rəbbinin elçisidir. Bunu Allah haqq olaraq, aləmlərə rəhmət olaraq göndərib. Oradakılar: «Bunu haradan bilirsən?» deyə soruşdular. O: «Siz nə zaman ki, buraya gəldiniz bütün daşlar və ağaclar səcdəyə qapandılar. Belə ki, onlar Peyğəmbərdən başqasına səcdə etməzlər və mən onun iki kürək sümüyü arasındakı Peyğəmbərlik möhürünü də bilirəm. Bu bizim kitabımızda yazılmışdır. Yəhudilərdən ona bir zərər gələ bilməsindən qorxduğu üçün əmisinə onu Şama gətirməməsini söyləyir. Əmisi onu uşaqları ilə birlikdə Məkkəyə geri göndərir. Məkkəyə qayıtdıqdan sonra isə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Məkkə xalqının qoyunlarını otarmağa başlayır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurur: «Elə bir Peyğəmbər yoxdur ki, çobanlıq etmiş olmasın» .

**3.** ***Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – İn Doğumuna Dəlalət Edən Bəzi Qəribə İşarələr Vardır:***

**1-** Atasının adının Allahın qulu mənasına gələn «Abdullah» olması. Tövhidə və Allaha qulluğa dəlalət edər. **2-** Anasının adının əminlik və arxayınçılıq olan «Əminə» olması. **3-** Onu ilk əmizdirən qadının isminin savab mənasında olması «Suveybə». **4-** Süd anasının adının yumşaqlıq və mülayimlik olan «Həlimə» olması və onun da şans mənasına gələn Sad qəbiləsinə mənsub olması. **5-** Muhəmməd və Əhməd İsimlərinin Allaha həmd və şükr mənasına gəlməsi. Bütün bu işarələr bir təsadüf deyildir. Bunlar yalnız Allahın yazdığı qədərə bağlı olaraq bir yerdə cəm olmuşdur.

***Həmçinin:*** Birinci günün onun həyatında yeri: Rəbiul Əvvəl ayının **1-**ci günü dünyaya gəldi, Rəbiul Əvvəl ayının **1-**ci günü Peyğəmbərlik verildi, Rəbiul Əvvəl ayının **1**-ci günü hicrət etdi, Rəbiul Əvvəl ayının 1-ci günü vəfat etdi. Hikmətini Allah bilir.

**4.** ***Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – İn İsimlərini Bilmək:***

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mənim İsimlərim var. Mən ***Muhəmmədəm***, mən ***Əhmədəm***, mən ***Məhi*** (məhv edici) Allah mənimlə küfrü məhv edər. Mən ***Həşirəm*** – insanlar mənim ayaqlarımın izi ilə həşr olunurlar. Mən ***Aqibəm***. Akib isə məndən sonra Peyğəmbər göndərilməyəndir» . Bu adlardan başqa: ***Muxtar*** (seçilmiş), ***Mustafa*** (arındırılmış), ***Şəfi*** (şəfaət edən), ***Muşəffə*** (şəfaət etdirilən), ***Sadiqul-Məsduq*** (doğru söyləyən və sözü doğrulanan) İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, doğru sözlü və doğru sözü təsdiq olunan Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu…» , ***Fatih*** (fəth edən), ***Kusam*** (toplayan, birləşdirən, mükəmməl), ***Muqaffi*** (özündən əvvəl gələn Peyğəmbərlərin izini silən, sonuncu mənasındadır), ***Nəbiy Tövbə*** (tövbə Peyğəmbəri), ***Nəbiy Mulhamə*** (Allah düşmənləri üçün cihad üçün göndərilən), ***Mutəvəkkil*** (sadəcə Allaha təvəkkül edən) , ***Bəşir*** (itaət edəni müjdələyən, asi olanı cəza ilə qorxudan), ***Rauf*** (çox şəfqətli), ***Rahim*** (çox mərhəmətli). «Qurani Kərimdə keçən adlardan: ***Şahid, Mubəşşir*** (müjdəliyən), ***Sirac***, ***Munir***, ***Seyyidi Vələdi Adəm*** (Adəm övladlarının seyyidi) , ***Rahmə*** (rəhmət), ***Nimə*** (nemət), ***Hadi*** (doğru yola yönəldən), ***Əmin*** (güvənilir) Qureyş onu Peyğəmbərlik verilməmişdən qabaq da bu adla çağırırdı, ***Muzəmmil*** (örtüyünə bürünən), ***Mudəssir*** (paltarına bürünən), ***Dailallah*** (Allaha dəvət edən) və s. İbn Dihyə – *rahmətullahi*

---

[796] Tirmizi 4/516, İmam Məlik 2/971, İbn Məcə 2148, Buxari 9/488, Müslim 14/5,6.
[797] Buxari, Müslim.
[798] Buxari, Müslim.
[799] Buxari 8/450 Fəth surəsinin təfsiri.
[800] Buxari 8/300, Müslim «İman» 194/2278.

*aleyhi* – deyir ki: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in adlarının sayı Uca Allahın adlarının sayı qədər doxsan doqquzdur» . İmam Zəhəbi – *rahmətullahi aleyhi* – deyir ki: «Onun adları arasında ***Dahuq*** (gülər üz) və ***Kattal*** (çox savaşan) adları da vardır». Əli - *radıyallahu anhu* – deyir ki: «Allah onun üstünlüyünü ortaya qoymaq üçün ona öz adından törəmə bir ad qoydu: «Ərşin sahibinin adı ***Mahmud***, onun adı isə ***Muhəmməd***» .

**5. *Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – İn Övladlarını Tanımaq:***

**25** yaşında ticarət məqsədi ilə Şama səfər edir. Qayıtdıqdan sonra Xuveylidin qızı Xədicə - *radıyallahu anhə* – ilə evlənir. Mehiri **10** cavan dəvə, bir rəvayətə görə isə **6** cavan dəvə idi. İlk zövcəsi Xədicə b. Xuveylid b. Əsəd b. AbdilUzzadır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onunla **25** yaşında evlənir. Xədicə - *radıyallahu anhə* – nin isə **40** yaşı var idi. Xədicə - *radıyallahu anhə* – Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən qabaq Atik b. Aiz əl-Mahzumi ilə evlənmiş o, öldükdən sonra isə Əbu Halə əl-Teymi ilə evlənmişdir və bir uşağı olduqdan sonra o, da vəfat etmişdir. Xədicə - *radıyallahu anhə* – hicrətdən **3** il əvvəl, bəzi rəvayətlərə görə **1** il əvvəl vəfat etmişdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – o, ölüncəyə qədər başqa bir qadınla evlənməmişdir. İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir ki: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in İbrahimdən başqa bütün övladları bu qadından olmuşdur». Birinci oğlu ***Qasım*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə peyğəmbərlik verilməmişdən qabaq dünyaya gəlir və **2** ay yaşadıqdan sonra vəfat edir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onun adı ilə kunyələnərək Əbul Qasım (Qasımın atası) deyə çağrılırdı. Ənəs - *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bazarda bir nəfərin başqasına: «Ey Əbul Qasım!» deyərək səslədiyini eşitdi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – o, tərəfə baxaraq: «Mənim adımı götürün lakin mənim kunyəmlə kunyələnməyin» deyə buyurdu . İbn Həcər Bağavi – *rahmətullahi aleyhi* – deyir ki: «Bu ixtilaflı məsələdir və bu haqda bir neçə görüş vardır. Bəzilərinə görə bu qadağa yalnız onun yaşadığı dövürə aiddir, bəziləri də deyirlər ki, iki adı da birdən götürmək qadağandır (Həm Muhəmməd, həm də Əbul Qasım kunyəsini)» . İkinci oğlu ***Abdullahdır***, ***Tahir*** və ***Tayyib*** olaraq da adlandırılmışdır. Bəziləri də qeyd edirlər ki, bunlar başqa övladlarıdır. Lakin doğru olan birincisidir. Peyğəmbərlikdən sonra dünyaya gəlmişdirlər. Üçüncü oğlu ***İbrahimdir***. Hicri **8**-ci ildə Mədinədə dünyaya gəlmiş və hicri **10**-cu ildə **17** və ya **20** aylıq ikən vəfat etmişdir. Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – oğlu İbrahim öldüyü zaman buyurdu: «O, körpə ikən öldü. Onun Cənnətdə iki süd anası vardır. Onlar onun südünü iki ilə tamamlayacaqlar. Çünki o, mənim oğlumdur» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in zamanında günəş tutuldu. İnsanlar: «Günəş İbrahimin ölümünə görə tutulmuşdur» dedilər. Peyğəmbər: «Həqiqətən günəş və ay Allahın rəmzləridir. Onlar heç kəsin ölmünə və ya doğumuna görə tutulmurlar…» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in **4** qızı olmuşdur. ***Zeynəb*** **-** *radıyallahu anhə* –. Onunla Halə b. Xuveylidin oğlu Əbul As b. Rəbi b. AbdulUzza b. AbduşŞəms evlənmişdir. ***Fatimə*** **-** *radıyallahu*

---

[801] əl-Fəth 6/643,644.
[802] Zəhəbi «Siyer» 2/10: Bu adlar üçün Səhih Müslimə bax: 2354,2355.
[803] Buxari 6/647.
[804] Fəthul Bəri 6/648.
[805] Müslim 2316.
[806] Buxari, Müslim.

*anhə* –. Onunla Əli b. Əbu Talib - *radıyallahu anhu* – evlənmişdir. Övladları: Həsən, Hüseyn, Zeynəb, Ümmu Gülsüm - *radıyallahu anhum* –. ***Ruqiyyə*** və ***Ummu Gülsüm*** - *radıyallahu anhum* –. Bu ikisi ilə Osman - *radıyallahu anhu* – evlənmişdir. Əvvəlcə Ruqiyyə ilə evlənmiş (onun ölümündən sonra) Ummu Gülsüm ilə evlənmişdir. Hər ikisi də onun nigahı altında vəfat edir. Buna görə də Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Osman - *radıyallahu anhu* – nu ***Zinnureyn*** (iki nur sahibi) olaraq adlandırmışdır. Ruqiyyədən olan övladı: Abdullahdır. Hicrətin **2**-ci ilində Ramazan ayında Bədr günündə vəfat etmişdir. Ummu Gülsüm isə hicrətin **9**-cu ilində Şaban ayında vəfat etmişdir. Fatimə - *radıyallahu anhə* – dən başqa bütün övladları Peyğəmbərdən əvvəl vəfat etmişlər. Yalnız Fatimə - *radıyallahu anhə* – Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən **6** ay sonra vəfat etmişdir .

**6. *Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – İn Xanımlarını Tanımaq:***

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in **13** zövcəsi olub. Bunlardan **11** ilə yaşamış, **2**-si ilə yaxınlıq etməmiş onları boşamışdır. ***Cevniyyə*** adlı bir qadına evləmmək xəbərini göndərir. Lakin qadın Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən Allaha sığındığı üçün Allah da onu qorudu. Evlənməyərək onu ailəsinə geri göndərdi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – vəfat etdikdə zövcələrindən **2**-si ***Xədicə B. Xuveylid***, ***Zeynəb B. Xuzeymə*** - *radıyallahu anhə* – vəfat etmiş, **9** isə sağ idi. Xanımlarının ilki ***Xədicə B. Xuveylid*** b. Əsəd b. Abdiluzzadır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onunla **25** yaşında ikən evləndi. O, ölüncəyə qədər başqa bir qadınla evlənmədi. Məkkə qadınları arasında «Tahirə» (təmiz qadın) adı ilə çağrılırdı. İbnul Əsir – *rahmətullahi aleyhi* – deyir ki: «Müsəlmanların fikrinə görə Xədicə, Allahın qulları arasında Müsəlman olan ilk insandır. Onan əvvəl heç bir kişi və ya qadın Müsəlman deyildi». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnsanlar məni inkar etdiyi zaman o mənə iman gətirdi. İnsanlar məni yalanladıqda (yalan saydıqda) o məni doğrultdu (doğru saydı). İnsanlar məni (mallarından) məhrum etdikdə o mənə malı ilə dəstək oldu. Allah məni başqa qadınların uşaqlarından məhrum buraxdıqda, məni onun uşağı ilə ruziləndirdi» . Əli - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Zamanında dünya qadınlarının ən xeyirlisi İmranın qızı Məryəmdir. Bu ümmət qadınlarının ən xeyirlisi də Xuveylidin qızı Xədicədir» . Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Hira mağarasında ikən yanına Cəbrail – *əleyhissəlam* - gəldi və dedi: «Ya Rəsulallah! Bu Xədicədir. Sənə doğru gəlir. Yanında bir qab da vardır. Xədicə sənin yanına çatdıqda ona Allahdan və məndən salam de və ona söylə ki, Cənnətdə onu səsdən, gurultudan və məşəqqətdən uzaq daş-qaşlı bir saray gözləyir» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ona olan sevgisini və vəfasını qorumuşdur. Xədicə - *radıyallahu anhə* – nin vəfatından sonra, onun dostlarına (yaxınlarına) hörmət edirdi. Aişə - *radıyallahu anhə* – belə deyir: «Bəzən bir qoyun kəsər, sonra parçalara ayırar, sonra Xədicənin dostlarına göndərərdi. Bəzən Ona «Sanki dünyada Xədicədən başqa heç bir qadın yoxdur» deyərdim. Belə deyərdi: «O belə, belə idi və mənim ondan uşağım oldu» . Sonra ***Sevda B. Zema*** - *radıyallahu anhə* – ilə

---

[807] İbn Həzm «Cəvamius Sıra» 40, Təhzibul Əsmə vəl Luğət 1/26.
[808] İmam Əhməd.
[809] Müslim 2430.
[810] Müslim 2432.
[811] Buxari.

evləndi. Evləndikdə **55** yaşı var idi. Sonra Məkkədə Əbu Bəkr - *radıyallahu anhu* – nun qızı ***Aişə*** - *radıyallahu anhə* – ilə nigahlandı. O, zaman o, **6** yaşında idi və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onunla hicrətdən sonra **9** yaşında ikən bir araya gəldi. Aişə - *radıyallahu anhə* – hicrətin **58**-ci ilində vəfat etdi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə birlikdə **9** il **5** ay bir yerdə olmuşlar. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dünyadan köçdüyü zaman onun **18** yaşı var idi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in zövcələri onun ölümündən sonra ömürlərinin sonuna qədər heç bir kimsə ilə evlənməmişlər. Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ona buyurdu: «Ya Aişə! Bu Cəbraildi, sənə salam söyləyir». Aişə: «***Və Aleyhis Səlamu Və Rahmətullahi*** – Allahın salamı və rəhməti onun üzərinə olsun» deyə cavab verdim . Aişə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ya Aişə! Sən **3** gecə yuxumda mənə göstərildin. Sənin surətini mənə ipəkli bir parçada mələk gətirdi və: «Bu rəsmin sahibi sənin zövcəndir!» dedi. Nəhayət mən sənin üzünü açınca baxdım ki, o surət sənsən» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Aişənin (digər) qadınlara üstünlüyü, səridin (ət və çörək parçalarından düzəldilən və ərəblərdə digər yeməklərdən üstün olan bir yemək növü) digər yeməklərdən üstünlüyü kimidir» . Amr b. As - *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən soruşdum: «İnsanların hansı sənə ən sevimlidir, ey Allahın Rəsulu?». Rəsulallah: «Aişə» deyə buyurdu. Mən: «Bəs kişilərdən?» deyə soruşduqda: «Onun atası» deyə cavab verdi . Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, mən heç bir qadın haqqında Xədicəyə qarşı qısqandığım dərəcədə qısqanc olmadım. Halbuki o, Peyğəmbərin mənimlə evlənməsindən **3** il əvvəl vəfat etmişdir və mən onu əsla görməmişdir. Ona qarşı olan qısqanclığımın səbəbi Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in onun adını tez-tez zikr etməsinə görə idi . Hicrətdən **2** il sonra Ömər - *radıyallahu anhu* – nun qızı ***Həfsə*** - *radıyallahu anhə* – ilə evləndi. Abdullah b. Ömər - *radıyallahu anhu* – deyir ki, (atam) Ömər - *radıyallahu anhu* – qızı Həfsə - *radıyallahu anhə* – nin dul qalmasını belə anladır . Ömər: «Osman - *radıyallahu anhu* – ilə qarşılaşdım və qızım Həfsəni ona ərz edib dedim. İstəyirsən Həfsa b. Öməri sənə nigahlayım». (Cavab olaraq) O: «Mən bu haqda fikirləşib sənə deyərəm» dedi. Mən bir neçə gün gözlədikdən sonra o, mənimlə görüşüb dedi: «Bu günlərdə evlənmək qərarına gəlməmişəm» dedi. (Bir müddətdən sonra) Əbu Bəkr əs-Sıddık - *radıyallahu anhu* – ilə qarşılaşdım. Ona da: «İstəyirsən qızım Həfsə b. Öməri sənə nigahlayım» dedim. Əbu Bəkr heç bir söz deməyib susdu. Ona, Osmana qəzəb etdiyimdən də çox qəzəbləndim. Bir neçə gündə gözlədikdən sonra qızımı Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə niğahladım. Sonra Əbu Bəkr - *radıyallahu anhu* – məni görüb: «Yəqin Həfsə - *radıyallahu anhə* – ni mənə nigahlamaq istədikdə mənim cavab vermədiyimi görüb qəzəbləndin» dedi. Mən: «Bəli» dedim. O: «Sənə cavab verməkdə mənə yalnız bir şey mane olurdu. O, da Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sənin qızınla nigah etmək istədiyini bildiyim üçün. Mən də Peyğəmbər – *sallallahu aleyhi və səlləm*

---

[812] Müslim 2447.
[813] Müslim 2438.
[814] Buxari, Müslim.
[815] Buxari.
[816] Müslim 2432.
[817] Həfsə - *radıyallahu anhə* – nin yodaşı Hunays b. Xuzeyfə əs-Saxmi - *radıyallahu anhu* – idi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – səhabələrindən idi. Bədr döyüşündə aldığı yaradan Mədinədə ölür.

– in sirrini ifşa edib aça bilmərəm. Əgər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onunla evlənməkdən vaz keçsəydi, əlbəttə mən onunla evlənərdim» dedi . Həfsə - *radıyallahu anhə* – Mədinədə hicrətin **45**-ci ilində vəfat etdi. Cənazə namazını o, zaman Mədinə vəlisi Mərvan qılır. Sonra əsl adı Hind b. Əbi Umeyyə olan ***Ummu Sələmə*** - *radıyallahu anhə* – ilə evləndi. Ən son ölən xanımıdır. Onunla evləndikdə dul idi və 6 uşağı da vardı. Hicrətin **59**-cu ilində **60** yaşında Yezidin xəlifəliyi dönəmində vəfat etmişdir. Sonra ***Zeynəb B. Cəhş*** - *radıyallahu anhə* – ilə evləndi ki, o da Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in vəfatından sonra xanımlarından ən tez vəfat edəndir. Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in zövcələrindən bəziləri: «Ey Allahın Rəsulu! Hansımız sənə daha tez qovuşacağıq» dedilər. Peyğəmbər: «Qolu ən uzun olanınız» deyə buyurdu. Onlar da bir ölçü alıb qollarını ölçməyə başladılar. Ən uzun qolu olan Sevda b. Bilaharə oldu. (Başqa rəvayətdə: Zeynəb b. Cəhş - *radıyallahu anhə* – idi). Onun qolunun uzunluğunda (olan) murad sədəqə imiş. Çünkü o, çox sədəqə verməyi sevərdi. İlk öncə ona qovuşan da o, oldu . Aişə - *radıyallahu anhə* – deyir: «Dini baxımından Zeynəbdən daha xeyirli, Allahdan daha qorxan, daha doğru sözlü, əqrəbalıq bağlarına daha çox diqqət yetirən və daha çox sədəqə verən bir qadın görmədim». Ömər - *radıyallahu anhu* – nun xəlifəliyinin ilk dönəmlərində (Bax: əl-Əhzab 37). Sonra ***Cuveyriyyə B. Hərislə*** - *radıyallahu anhə* – evləndi. Bu qadın kölə olur. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onu azad edib alır. Hicri **26**-cı ildə Rəbbiul-Əvvəl ayında vəfat etdi və cənazəsini Mərvan qıldırdı. Sonra ***Ummu Həbibə*** - *radıyallahu anhə* – ilə evləndi. Onun da əsl adı ***Rəmlə*** idi. Əbu Sufyan b. Hərbin qızı idi. Həbəşistana hicrət edənlərdən idi. Hicri **44**-cü ildə Muaviyə - *radıyallahu anhu* – nun xəlifəliyi dönəmində vəfat etmişdir. Xeybərin fəth edilməsindən sonra Nadir oğullarından Huyey b. Ahtabın qızı ***Səfiyyə*** - *radıyallahu anhə* – ilə evləndi. Bu qadın Harun – *əlehissəlam* – ın sülaləsindən idi. Hicri **50**-ci ildə **52** yaşında vəfat etmişdir. ***Zeynəb B. Xuzeymə*** - *radıyallahu anhə* – ilə evlənir. Evləndikdə dul idi və 60 yaşın içində idi. Evləndikdən **2** il sonra vəfat edir. Sonra ***Meymunə B. Hərislə*** - *radıyallahu anhə* – evləndi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in ən son evləndiyi qadın budur. Muaviyə - *radıyallahu anhu* – nun xəlifəliyi dönəmində Şərəfdə vəfat etmişdir. Qəbri də hələ də oradadır. ***«(Peyğəmbərin) zövcələri möminlərin analarıdır».*** *(əl-Əhzab 6).*

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in **4** cariyəsi də vardır: Bunlar ***Mariyə*** - *radıyallahu anhə* –, hansı ki, İbrahim adlı övladı da ondan idi. ***Reyhanə B. Zeyd, Əbu Ubeydə*** və əsirlər arasından götürdüyü bir cariyə. Bunları azad edib evlənmişdir . Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, Caunun qızı Allah Rəsulunun hüzuruna gətirildikdə Allahın Rəsulu ona yaxınlaşmaq istədi, lakin bunu görən qız dedi: «Səndən Allaha pənah aparıram». Peyğəmbər: «Sən əzəmətli Allaha pənah apardın. İndi isə ailənə dön» deyə buyurdu . Daha sonra Allah ona tək qalmağı və Rəbbinə ibadət etməyi sevdirir.

***7. Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – İn Əmilərini, Bibilərini, Dayılarını Və Xalalarını Tanımaq:***

---

[818] Buxari 4005.
[819] Buxari «Zəkat» 11, Nəsai «Zəkat» 66,67.
[820] İbn Həzm «Cəvamius Sıra» 40, İbn Əsakir «Tarixu Dəməşq» 1/136-138, Təhzibu Əsməu vəl Luğət 1/27.
[821] Buluğul Məram «Nigah».

***Əmiləri:*** Allahın və elçisinin aslanı, şəhidlərin başçısı ***Həmzə b. AbdulMuttalib***, ***Abbas***, ***Əbu Talib*** (adı: Abd Mənaf), ***Əbu Ləhəb*** (adı: Abd əl-Uzza), ***Zubeyr***, ***Abd əl-Kaba***, ***əl-Mukavvim***, ***Dirar***, ***Kusam***, ***Muğirə, Giydaq*** (adı: Nofəl). İçlərində müsəlman olanları sadəcə Həmzə və Abbas - *radıyallahu anhum* – dur.

***Bibiləri:*** Zubeyr b. Avvamın anası ***Səfiyyə***, ***Atiqə***, ***Bərra***, ***Ərva***, ***Umeyyə*** və ***Ummu Hakim əl-Beydə***. Bunlardan yalnız Səfiyyə - *radıyallahu anhə* – müsəlman olmuşdur (Bəzi rəvayətlərdə: Atiqə və Ərvada müsəlman olmuşlar).

***Dayıları: Əsvəd, Umeyr*** və ***Abdiyğeus.*** Üçü də Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Peyğəmbərliyindən öncə ölmüşlər.

***Xalaları: Fureysa*** və ***Fahitə***. İkisi də Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Peyğəmbərliyindən öncə ölmüşlər.

**8. *Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – İn Kölələri:***

***Kişi Kölələr*** - Zeyd b. Həris b. Şərahil. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onu çox sevərdi. Onu azad edib Ummu Əymənlə evləndirdi. Bu evlilikdən Usamə - *radıyallahu anhu* – dünyaya gəlmişdir. Əsləm, Əbu Rafi, Sovban, Əbu Kəbşə, Suleym, Şurkan (Saleh), Ribah Nubi, Yəsar Nubi – Uranilərin qatili -, Kirkira – Abdullah b. Amr - *radıyallahu anhu* – rəvayət edir ki: «Kirkira adında bir nəfər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – üçün ağır yükləri daşıyırdı. Ölümündən sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «O, Cəhənnəmdədir». İnsanlar ona baxmağa getdikdə evindən (qənimətdən) gizlətdiyi əbanı gördülər» . Midam – Ömər b. Xəttab - *radıyallahu anhu* – rəvayət edir ki: «Xeybər günü Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in səhabələrindən bir qrupu gəldi və: «Fialnkəs şəhiddir, filankəs şəhiddir» dedilər. Peyğəmbər: «Xeyr, mən onu oğurladığı bir paltardan ötrü Cəhənnəmdə gördüm (Başqa rəvayətdə: Vadi Kuraya gəldik. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanında Dubeyd oğullarından Rifaa b. Zeyd adlı bir köləsi vardır. Bu köləni ona Cuzəm qəbiləsindən bir nəfər hədiyyə etmişdir. Bu an bir ox ona batdı və dünyasını dəyişdi. Səhabələr: «Ya Rəsulullah! Ona şəhadət mübarək olsun». Peyğəmbər: «Xeyr, Allaha and olsun ki, Xeybər hərbindən bölünməmiş qənimətdən götürdüyü bir tək örtük onun üstündə atəş olub yanmaqdadır» deyə buyurdu)» buyurdu . Əncəşə – közəl səsli bir xidmətçi idi. Qadınların mindikləri dəvələri sürərdi .

***Qadın Kölələr –*** Səlmə Ummu Rafi, Meymunə b. Sad, Hudra, Ridva, Reziynə, Ummu Dumeyrə, Meymunə b. Useyd, Mariya və Reyhanə.

**9. *Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – İn Xidmətçiləri:***

***Xidmətçiləri*** - Ənəs b. Məlik, İbn Məsud, Ukbə b. Amr əl-Huhəni, Əslağ b. Şərik, Bilal, Ribah, Sad, Əbu Zərr, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in azad etdiyi Əymən b. Ubeyd və anası Ummu Əymən - *Allah onlardan razı olsun* - .

**10. *Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – İn Katibləri:***

***Katibləri*** - Əbu Bəkr, Ömər, Osman, Zubeyr, Amr b. Fuheyrə, Amr b. əl-Ass, Ubeyy b. Kəbb, Sabit b. Qeys, Muğirə b. Şöbə, Abdullah b. Ravaha, Xalid b. Vəlid, Muaviyə b. Əbu Sufyan, Xalid b. Said b. əl-Ass, Abdullah b. əl-Ərkam, Hənzələ b. Rabi əl-Useydi və Zeyd b. Sabit - *Allah onlardan razı olsun* - .

---

[822] Buxari 3074.
[823] Müslim 114,115.
[824] Müslim 2323, Kölələrdən ilk müsəlman olan Bilal b. Rabia - *radıyallahu anhu* – dur.

**11.** ***Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – Dən Ən Çox Hədis Rəvayət Edən Səhabələr:***

Əbu Hureyrə **5374**, İbn Ömər **2630**, Ənəs b. Məlik **2286**, Aişə **2210**, İbn Abbas **1660**, Cabir b. Abdullah **1540**, Əbu Səid əl-Xudri **1170**, İbn Məsud **848**, Abdullah b. Amr b. əl-Ass **700**, Ömər **537,** Əli **536** – *Allah onların hər birindən razı olsun* -

**12.** ***Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – İn Müəzzinləri Və Şairlər:***

***Müəzzinləri*** - Mədinədə Bilal b. Ribah və Ömər b. Ummu Məktub əl-Quraşi əl-Amiri əl-Ama. Quba məscidində Ammar b. Yəsir və Sad əl-Kurz. Məkkədə isə Əbu Məhzura idi. ***Şairləri*** **–** Kəb b. Məlik, Abdullah b. Rəvaha, Həsən b. Sabit. ***Xatibi*** **–** Sabit b. Qeys b. Şəmmasdır. ***«Ey iman gətirənlər! Səsinizi Peyğəmbərin səsindən artıq qaldırmayın və bir-birinizlə ucadan danışdığınız kimi onunla ucadan danışmayın. Yoxsa özünüz də bilmədən əməlləriniz puç olar».*** *(əl-Hucurat 2).* Sabit b. Qeys - *radıyallahu anhu* – Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in xatibi idi və onun yanında xütbə verərkən uca səslə danışardı. Bu ayə nazil olduqdan sonra Qeys bir neçə müddət Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəlmir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Sad b. Muaz - *radıyallahu anhu* – ya deyir ki: «Sənin qonşun Qeys haradadır?». Sad - *radıyallahu anhu* – ona baş çəkməyə gedir və görür ki, Qeys evində qorxu içərisində oturaraq ağlayır və deyir ki: «Mənim əməllərim puç olmuşdur, artıq mən Cəhənnəm əhlindənəm. Çünki səsimi Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanında qaldırmışam». Sad - *radıyallahu anhu* – bu xəbəri Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – söylədikdə: «Xeyr, o Cənnət əhlindəndir» deyə buyurdu .

**13.** ***Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – İn Silahları Və Minikləri:***

***Doqquz Qılıncı Var İdi:*** Masur – ilk sahib olduğu qılınc idi. Atasından qalmışdır. əl-Abd, Zülfüqar – Bədr döyüşündə qənimətdən götrülmüşdür (Başqa rəvayətdə: Abdullah b. Said öz babasından rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Məkkənin fəthi günü Məkkəyə daxil olduqda qılıncında qızıl və gümüş vardı. Talib b. Xudayr dedi: «Gümüş qılıncın hansı hissəsində idi?». O: «Sapında (tutacağı)» ). əl-Kali, əl-Bəttar, əl-Hətf, əl-Rasub, əl-Mihzəm, əl-Kadib. ***Yeddi Zirehi Var İdi:*** Zat əl-Fudul, Zat əl-Vişah, Zat əl-Havaşi, əl-Sağdiyə, Fiddə, əl-Bətra, əl-Hirnik. Uhud döyüşündə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in əynində iki zirehi var idi . ***Altı Yayı Var İdi***: əl-Zavra, əl-Kətum, əl-Sadad, əl-Safra, əl-Beyda. əl-Kətum Uhud döyüşündə qırılmışdır. əl-Zəluq və əl-Futak adlı iki qalxanı var idi. ***İki Miğfəri (Dəbilqə) Var İdi:*** Miğfər – başa geyinilən zirehdir. Rəvayətdə gəlir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Məkkənin fəthi günü başında Miğfər Məkkəyə girdi. Miğfəri başlarından çıxartdıqları zaman başlarında qara rəngdə sarğı vardı . Cabir, İbn Abbas - *radıyallahu anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Məkkənin fəthi günü (İnsanlara xütbə verərkən) Məkkəyə daxil olduqda başında qara çalma (əmmamə) vardı (Başqa rəvayətdə: İbn Ömər - *radıyallahu anhum* – deyir ki, mən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in çalmasını necə bağladığını gördün. Əksər hallarda o, çalmanın ucunu belinə atardı)» .

---

[825] Buxari 3613, Müslim.
[826] Tirmizi «Şəmaili Şərif».
[827] Tirmizi «Şəmaili Şərif».
[828] Tirmizi «Şəmaili Şərif».
[829] Tirmizi «Şəmaili Şərif».

Təbərani «Mucəm». İbn Abbas - *radıyallahu anhu* – dan rəvayət edir: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Zülfüqar adlı gümüşdən qılıncı (Başqa rəvayətdə: Qılıncın tutacağı gümüşdən idi ), əl-Sədad adlı yayı, əl-Cəm adlı oxu, Zat əl-Fudul adlı zirehi, əl-Mucəz adlanan bir qalxanı, əl-Səkb adlanan bir atı, əl-Qasva adlanan dəvəsi, Yağfur adlanan bir eşşəyi, əl-Kinn adlanan bir çadırı, əl-Kumra adlanan ucu dəmirdən bir sopası, əl-Mevt adlanan bir əsası, əl-Ukab adlı sarı bayrağı, əl-Reyyan və Muğni adlı gümüş zəncir taxılmış iki bayrağı da var idi. əs-Səkb adlı atını **400** yüz dirhəmə çöl ərəblərindən almışdır. Qara rəngdə idi. əl-Murtəcəz qır rəngli idi. Xuzeymə b. Sabit - *radıyallahu anhu* - bu atın üzərində şəhid olmuşdur. əl-Luhayf, əl-Lizaz, əl-Zarib, əl-Vərd, Sabha bunlarda Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in atları olmuşlar. Duldul adlı qatırı ona əl-Muqavkis hədiyyə etmişdir. Fidda adlı qatırı isə Fərva əl-Cuzami və əlavə olaraq iki qatırı da var idi. Dəvələrindən əl-Qasva – Hudeybiyyə sülhündə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in dəvəsi yerə çökdü və insanlar: «Hü! Hü!» deyə dəvəni yerindən tərpətməyə çalışdılar. Lakin dəvə çökdüyü yerdən qalxmadı və onlar: «Qasva inadkarlıq edib qalxmır!» dedilər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qasva inadkarlıq etməz! Bu onun adəti deyildir. Lakin (bir zamanlar Məkkəyə daxil olmaq istəyən) fili tutub saxlayan Allah indi də Qasvanı saxladı . əl-Abda, əl-Cəda (ikisi də qulağı kəsik mənasındadır). əl-Abda yarışda keçilməz bir dəvə idi. Lakin bir çöl ərəbi yük dəvəsi ilə gəldi və onu keçdi. Səhabələr bundan üzüldülər. Peyğəmbər: «Allah dünyada ikən yüksələn bir şeyi mütləq bir gün alçaldar» . Burnu gümüş halqadan olan Mehri cinsindən Əbu Cəhlin dəvəsini Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Bədr döyüşündə qənimət olaraq götürmüşdü. Hudeybiyyə günü isə onu hədiyyə etdi . Bundan başqa artmalarını istəmədiyi yüz qoyunu, yeddi dənə südü gec kəsilən keçisi vardır ki, bunları da Ummu Əymən otarırdı.

**14. *Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – İn Məktubları:***

***Həbəşi Kralı Nəcaşi*** – əsl adı Əshəmə b. Əbcardır. «Rahmən və Rahim olan Allahın adı ilə. Hidayətdə olanlara, Allah və Rəsulunun salamı olsun. Mən şəhadət edirəm ki, Allahdan başqa ibadətə layiq heç bir haqq ilah yoxdur, O təkdir və şəriki də yoxdur, O nə doğmuş nə də doğulmuşdur. Yenə də şəhadət edirəm ki, Muhəmməd onun qulu və Rəsuludur. İslama gir və salamt ol! *«(Ya Muhəmməd!)* ***Söylə ki, Ey kitab əhli, sizinlə bizim aramızda eyni olan bir kəlməyə tərəf gəlin! Allahdan başqasına ibadət etməyək. Ona şərik qoşmayaq və Allahı qoyub bir-birimizi*** *(özümüzə)* ***Rəbb qəbul etməyək! Əgər onlar yenə də üz döndərərlərsə, o zaman*** *(onlara)* ***deyin: İndi şahid olun ki, biz həqiqətən müsəlmanlarıq.*** *(Allaha təslim olanlarıq)». (Ali İmran 64).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Nəcaşinin yanına elçi olaraq Amr b. Umeyyə əd-Damri - *radıyallahu anhu* – nu göndərmişdi. Nəcaşi məktubu alıb gözünə qoydu. Cəfər b. Əbu Talib - *radıyallahu anhu* – nun əli ilə müsəlman oldu. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə cavab məktubu yazaraq İslama girdiyini və müsəlman olduğunu yazdı. H. **9**-cu ili Rəcəb ayında vəfat edir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onun üçün cənazə namazı qılır. Peyğəməbr – *sallallahu aleyhi və səlləm* – müsəlman Nəcaşinin yerinə keçən krala da məktub yazmışdır. Lakin onun müsəlman

---

[830] Tirmizi «Şəmaili Şərif».
[831] Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in dəvəsinin adı idi.
[832] Buxari 2731, Müslim 1783.
[833] Buxari.
[834] Əhməd 1/261, Əbu Davud 1849, Tirmizi 815, İbn Məcə 3076.

olub-olmadığı bilinmir. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həbəşilərin sahibi Nəcaşinin vəfatını, öldüyü günü insanlara xəbər verdi (Başqa rəvayətdə: Bir qardaşınız ölmüşdür. Allahın yaxşı bir qulu Əshamə öldü). Xalqı musəlləyə çıxardıb dörd təkbir aldı (qardaşınız üçün (Allahdan) məğfirət diləyin)» .

***Bizans İmperatoru Herakl*** **-** «Rahmən və Rahim olan Allahın adı ilə. Allahın Rəsulu Muhəmməd – *sallallahu aleyhi və səlləm* – dən Rumun İmperatoru Herakla! Salam olsun doğru yolda olanlara! Sonra: «(Ey Rum imperatoru!) Mən səni İslama dəvət edirəm. İslamı qəbul et və canını qurtar. Allah da sənin əcrini iki qat versin. Əgər bu dəvətimi qəbul etməzsənsə ətrafındakı Xristianların da günahı sənin boynunadır. *«(Ya Muhəmməd!)* ***Söylə ki, Ey kitab əhli, sizinlə bizim aramızda eyni olan bir kəlməyə tərəf gəlin! Allahdan başqasına ibadət etməyək. Ona şərik qoşmayaq və Allahı qoyub bir-birimizi*** *(özümüzə)* ***Rəbb qəbul etməyək! Əgər onlar yenə də üz döndərərlərsə, o zaman*** *(onlara)* ***deyin: İndi şahid olun ki, biz həqiqətən müsəlmanlarıq.*** *(Allaha təslim olanlarıq)». (Ali-İmran 64).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – məktubu Herakla Dihyə b. Xəlifətil Kəlbi - *radıyallahu anhu* – ilə göndərmişdir. Herakl Xımsda Rumun böyüklərini hüzuruna dəvət etdi. Dəvət olunanlar saraya daxil olduqdan sonra (sarayın) qapılarının bağlanmasını əmr etdi. Sonra hündür bir yerə çıxaraq: «Ey Rum camaatı! Haqq yoluna yönəlmək və mülkünüzün qalmasını istəyirinizsə bu Peyğəmbərə beyət edin!» deyə xitab etdi. (Bu sözləri eşidcək) onlar vəhşi eşşəklər kimi qapılara doğru qaçmağa başladılar. Lakin qapıların bağlı olduqlarını gördülər. (Herakl) bu dərəcədə nifrətin və onun sözlərinin (onlar üçün) heç bir əhəmiyyət kəsb etmədiyini, onların iman gətirməyəcəklərinə ümüdünü kəsərək: «Onları geri çağırın!» deyə əmr etdi. (Onlar qayıtdıqda) O: «Mən bu sözləri yalnız sizi dininizə bağlılığınızı yoxlamaq üçün söylədim. İndi isə (sizin dininizə bağlılığınıza) gözlərimlə şahid oldum!» deyə cavab verdi. Bu sözlərdən sonra oradakılar (öz məmnuniyyətlərini bildirməkdən ötrü) onun qarşısında təzim olaraq səcdəyə qapandılar. Bu da Heraklı (İslam ilə bağlayan) son hadisə idi» .

***Misir Kralı Mukavkis*** **–** əsl adı Cureyc b. Minadır. «Rahmən və Rahim olan Allahın adı ilə. Allahın Rəsulu Muhəmməd – *sallallahu aleyhi və səlləm* – dən Qibtilərin böyük rəisi əl-Mukavkisə. Salam olsun doğru yolda olanlara! Sonra: «Mən səni İslama dəvət edirəm. İslamı qəbul et və canını qurtar. Allah da sənin əcrini iki qat versin. Əgər bu dəvətimi qəbul etməzsənsə ətrafındakı Qibtilərin də günahı sənin boynunadır. *«(Ya Muhəmməd!)* ***Söylə ki, Ey kitab əhli, sizinlə bizim aramızda eyni olan bir kəlməyə tərəf gəlin! Allahdan başqasına ibadət etməyək. Ona şərik qoşmayaq və Allahı qoyub bir-birimizi*** *(özümüzə)* ***Rəbb qəbul etməyək! Əgər onlar yenə də üz döndərərlərsə, o zaman*** *(onlara)* ***deyin: İndi şahid olun ki, biz həqiqətən müsəlmanlarıq.*** *(Allaha təslim olanlarıq)». (Ali-İmran 64).* Məktubu Mukavkisə elçi olaraq Xatib b. Əbi Bəltə - *radıyallahu anhu* – göndərmişdir. Bu yaxınlardan bir Peyğəmbərin Şam tərəfdən çıxdığını zənn edirdim - dedi. Lakin müsəlman olmadı. Misirin ən gözəl iki cariyəsini Mariyə və Sirin və bir də Duldul adlı eşşəyi də göndərdi. Sirini Həsən b. Sabitə verdi. Mariyə - *radıyallahu anhə* – ilə özü nigahlandı.

***Fars Kralı Kisra*** **–** «Rahmən və Rəhim olan Allahın adı ilə. Allahın Rəsulu Muhəmməd – *sallallahu aleyhi və səlləm* – dən İranlıların böyüyü Kisraya. Hidayətə

---

[835] Müslim 951.
[836] Buxari 7, Müslim 1773.

ittiba edən və Allah Rəsuluna inanan, ortağı və şəriki olmayan Allahdan başqa haqq ilah olmadığına, Muhəmmədin Onun qulu və Rəsulu olduğuna bəyan edənlərə salam olsun. Mən səni İslam dininə çağırıram. Çünki mən hər canlını dinə dəvət, kafirlərə qarşı Allahın sözünü yerinə yetirmək üçün bütün insanlar nəzdnində Allahın Rəsuluyam. O, halda İslamı qəbul et və salamat ol. Rədd edən Məcusilərin günahı sənindir. Məktubu elçi olaraq Abdullah b. Xuzafə əs-Səhmi - *radıyallahu anhu* – vermişdir. Məktubu oxuyan kimi parça-parça etdi və: «Mənim əlim altında olan bəsit bir qul öz adını mənim adımdan öncə yazmış» deyə qəzəbini bildirdi. Bu xəbər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – çatdı. Allah onun mülkünü dağıdsın. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in duası qəbul olundu. Öz oğlu onu devirərək hakimiyyətə keçdi. Ömər - *radıyallahu anhu* – nun dövründə isə darmadağın edildilər. İslam torpaqlarına qatıldılar.

***Dəməşq Rəisi Həris B. Əbi Şəmr Əl-Qassani* –** «Rahman və Rəhim olan Allahın adı ilə. Allah Rəsulu Muhəmməddən Həris b. Əbi Şəmrə. Hidayətə uyub Allaha iman edən və doğrulayana salam olsun. Mən səni heç bir şəriki olmayan bir və tək olan Allaha iman etməyə çağırıram. Belə edərsənsə məmləkətin sənə qalar». Bu məktubu Şuca b. Vəhb əl-Əsədi göndərmişdi. Məktubu oxuduqdan sonra tulladı və: «Kim mənim məmləkətimi məndən alacaqmış?».

***Yəmən Rəisi Həvzə B. Əli* -** «Rahman və Rəhim olan Allahın adı ilə. Allah Rəsulu Muhəmməddən Həvzə b. Əliyə. Hidayətdə olanlara salam olsun. Bil ki, dinim bütün Ərəbistana yayılacaqdır. İslamı qəbul et və salamat ol! Əlin altında olan mülkün sənə qalsın». Bu məktubu Suheyl b. Amr əl-Amiri göndərmişdir.

***Bəhreyn Kralı Unzir B. Savi* –** Ala b. əl-Hadrami İslama çağıran məktubu ona göndərdi. Məktubu alır-almaz qövmündən bir çox kimsəylə müsəlman oldu.

***Oman Kralı Cəfər Və Qardaşı* –** Məktubu Amr b. əl-Ass göndərmişdir. Məktubu alıb oxuduqdan sonra bir neçə gün düşündülər və İslamı qəbul etdilər. Bu hadisə fəthdən sonra baş vermişdir.

***Bəsrə Rəisi* –** Bəsrə rəisi üçün hazırladığı məktubu Həris b. Umeyr əl-Əzdi ilə göndərdi. Bu səhabə Mutə adlanan yerdə Şurahbil b. Amr əl-Qassani tərəfindən şəhid edilir. Bu Allah Rəsulunun elçisinə qarşı yönəldilmiş ən şiddətli bir hal idi. Onun bu çirkin davranışı döyüş demək idi. H. **8**-ci il Cəmədiul Əvvəl (Cumədəəl Ulə). Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – **3000** min nəfərlik bir ordu hazırlayaraq başlarına Zeyd b. Həris - *radıyallahu anhu* – nu qoydu və: «Zeyd öldürülərsə, Cəfər b. Əbu Talib - *radıyallahu anhu* – onun yerinə keçsin, o da öldürülərsə Abdullah b. Rəvaha - *radıyallahu anhu* – başçılığı ələ alsın» deyə buyurdu. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu döyüşdə iştirak etmir. Onlara nəsihət verərək buyurur: «Onları İslama dəvət edin, qəbul etməzlərsə döyüşün. Allahın adı ilə və Allahın yolunda çıxın. Xəyanət etməyin və həddi aşmayın. Uşaqlara, qadınlara, yaşlılara və evləri xaraba qoyub ağacları da kəsməyin». Tarixdə ən şiddətli döyüşlərdən biridir. **3000** minlik bir qüvvə **200000** minlik Roma və Ərəb qüvvələrinə qarşı. Belə də oldu bayrağı Zeyd b. Həris götürdü və şəhid olana qədər döyüşdü. Sonra bayrağı Cəfər götürdü sağ əli kəsildikdə bayrağı sol əlinə aldı. Bu əli də kəsildikdə bayrağı bağrına basdı və **90** yaxın yara alaraq şəhid edildi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu ki, Cəfərə iki qolu əvəzinə Cənnətdə qanad verilmişdir. «Cəfəri gördüm, Cənnətdə mələklərlə

birlikdə uçurdu» . Sonra bayrağı Rəvaha götürdü o, da şəhid olana qədər döyüşdü . Bundan sonra Sabit b. Ərqəm bayrağı əlinə alaraq qışqırdı: «Özünüzə başçı seçin». Xalid b. Vəlid başçı təyin edildi. Xalid - *radıyallahu anhu* – deyir ki, bu döyüşdə **9** qılınc sındırdım . Lakin sonra Allah zəfəri bizə müyəssər etdi. Ona bu döyüşdən sonra Seyfullah (Allahın qılıncı) ləqəbi verilmişdir.

**15.** ***Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – İn Hicrəti Beyəti Və Sülhü:***

Müşriklərin zülmü artdıqda Allah və Rəsulunun əmri ilə səhabələr Məkkədən Həbəşistana hicrət etməyə başladılar. İlk hicrət Nübuvətin **5**-ci ili Rəcəb ayında **12** kişi, **4** qadın hicrətə çıxmışdılar. Osman və zövcəsi Ruqiyyə də onlarla idi. Bu ailə İbrahim və Lut – *əleyhimussəlam* – dan sonra Allah yolunda hicrət edən ilk ailədir. Ciddənin yaxınlığında yerləşən Şueybə limanından iki ticarət gəmisi ilə yola düşürlər. Hicrət edənlərə xəbər çatır ki, Məkkədə Qureyş İslamı qəbul edib. Bu xəbəri eşidəcək hicrət edənlər geri dönürlər. Lakin xəbər doğru deyildi. İşkəncələr, zülmlər daha da artmışdı. İkinci hicrət zamanı isə artıq **83** kişi və **18** qadın hicrət edirlər.

Məkkə yaxınlığında Minanın yuxarı hissəsində Əqabə adlanan yerdə Ənsarlardan **6** (**8**) nəfər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – beyət edirlər. Nübuvətin **11**-ci ili Həzrəc qəbiləsindən Əsəd b. Zura, Auf b. Həris b. Rufaa, Rafi b. Məlik b. əl-Aclani, Kutbə b. Amir b. Cədid, Ukbə b. Amir b. Nabi, Cabir b. Abdullah b. Riab. Bir il sonra isə Nübuvətin **12**-ci ili **12** nəfər, bunlardan **10** Həzrəc qəbiləsindən, **2** isə Əus qəbiləsindən idilər. Yuxarıda adlarını qeyd etdiklərimiz və Muaz b. Həris, Zəvkan b. AbdulQeys, Ubadə b. Samit, Yəzid b. Sələbə, Abbas b. Ubadə b. Nadlə. Əus qəbiləsindən isə – Əbul Heysəm b. Teyyih, Uveym b. Saibə. Həmən il isə **73** nəfər. Bunlardan **63** Həzrəc qəbiləsindən, **11** isə Əus qəbiləsindən və **2** qadın Nəccar oğullarından Nəsibə b. Kaab, Sələm oğullarından Əsmə b. Amr Mədinədən gələrək Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – beyət edirlər.

Bir müdətdən sonra Allah Rəsuluna hicrət etmək izn verilir. Bu hadisə Nübuvətin **13**-cü ili Səfər ayının **26**-da Qureyş Darul Nədvə adlanan yerdə toplanaraq Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – i öldürmək qərarına gəlirlər. Cəbrail – *əleyhissəlam* - isə müşriklərin bu gizli işini Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə çatdırır. H. Əli - *radıyallahu anhu* – Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yerinə yatağında uzanır. ***«****(Ya Muhəmməd!)* ***Yadına sal ki, bir zaman kafirlər səni həbs etmək və ya öldürmək, yaxud da*** *(Məkkədən)* ***çıxardıb qovmaq üçün sənə qarşı hiylə qururdular. Allah da təbdir tökdü. Allah tədbir tökənlərin ən yaxşısıdır!».*** *(əl-Ənfal 30).* Mədinədə İslam yayıldığı üçün Məkkədən Rəbbiul Əvvəl – *Səfər ayında da deyirlər* – birinci günü çıxdı. Yanında Əbu Bəkr əs-Sıddıq və köləsi Amr b. Fuheyrə də var idi. Bələdçiləri isə Abdullah b. Uraykit əl-Leysi idi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – müşriklərin başına torpaq səpərək Yəsin surəsinin **9**-cu ayəsini oxuyurdu. ***«Biz onların önlərinə və arxalarına sədd çəkib gözlərini bağlamışıq».*** *(Yəsin 9).* Heç bir müşrik Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in onların yanlarından necə ötüb keçdiyini görmədilər. Müşriklər onları təqib edirdilər. Onların həps edilmələrinə və ya ölülərinə **100** dəvə vəd vermişdilər. Buna görə də yolda Sevr mağarasına girərək üç gün orada qalırlar. Mağaraya girdikdə oraya öncə Əbu Bəkr - *radıyallahu anhu* – girdi və içərini yoxladı. Gördüyü hər bir dəliyi paltarı ilə örtdü, digər dəliyi isə ayağı ilə

[837] Tirmizi 3763.
[838] Buxari 4261.
[839] Buxari.

bağladı. Beləcə zərərli həşəratların o, dəlikdən çıxaraq Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə zərər verməməsinin qarşısını aldı. Sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – içəri girdi və yatdı. Bu vaxt bir böcək Əbu Bəkir - *radıyallahu anhu* – nun ayağını sancdı. Əbu Bəkr - *radıyallahu anhu* – Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – i rahatsız etməmək üçün yerindən tərpənmədi. Lakin hiss etdiyi ağrıdan gözləri yaşardı və o yaşlar Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in üzünə düşdü. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – oyanaraq nə olduğunu soruşdu. Əbu Bəkr: «Bir böcək ayağımı sancdı» dedi. Peyğəmbər: «Anam-atam sənə fəda olsun» deyə buyurdu. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – böcəyin sancdığı yerə tüpürdü. Əbu Bəkr - *radıyallahu anhu* – nu ağrılarından əsər belə qalmadı. Əbu Bəkr - *radıyallahu anhu* – nun oğlu Abdullah gündüzləri müşriklərin yanında dolaşar, axşam isə onlara xəbərlər gətirirdi. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – Əbu Bəkr - *radıyallahu anhu* - ilə mağarada olarkən Əbu Bəkr - *radıyallahu anhu* - müşrikləri gördükdə qorxaraq: «Allaha and olsun ey Allahın Rəsulu, onlardan biri ayağının altına baxsa bizi mütləq görəcəkdir. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – ona Allahın buyurduğu şəkildə: ***«Qəm yemə, Allah bizimlədir».*** *(ət-Tövbə 40).* «Üçüncüləri Allah olan iki kişi barəsində sən nə düşünürsən» . Sonra sahillə yollarını davam edərək Mədinəyə Rəbiul Əvvəl ayının **12** birinci günü çatırlar. Mədinə yaxınlığında Qubada Amir b. Auf oğullarının yanında qonaqlayırlar. Onların yanında **10** gün qaldıqdan sonra Quba məscidini tikirlər. Cümə günü isə yola çıxırlar. Mədinəyə çatdılar. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in dəvəsi indiki məscidin ərazisində yerə çökür. Bu yer Bəni Nəccar oğullarından olan Əsəd b. Zurarın himayəsində yaşayan Səhl və Suheyl adlı iki yetim uşağa məxsus idi. Bu yer xurma qurudmaq üçün istifadə edilirdi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu yeri onlardan pulla alır. Sonra məscid və evi tikilənə qədər Əbu Əyyub əl-Ənsari - *radıyallahu anhu* – nun yanında qalır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Mədinəyə hicrət etmək xəbəri Həbəşistana çatdıqda **35** nəfər hicrət edərək Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəlirlər .

***Sülh*** **-** Misvər b. Məxrəmə - *radıyallahu anhu* – və Mərvan b. əl-Həkəm bir-birinin rəvayətini təsdiqləyərək demişlər: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Hudeybiyyə sülhündə iştirak etmək üçün (Mədinədən səfərə) çıxdı. Bu sülh müqaviləsi H. **6-7-**cı ili **628**-ci ildə Zil Qadə ayında baş verib. Sülh müqaviləsində iştirak edənlərin sayı **1400-1500** nəfər idi. Nəhayət gəlib Məkkəyə aparan Hudeybiyyə vadisindəki dağ yoluna çatdılar. Osman - *radıyallahu anhu* – elçi olara Qureyşin yanına göndərildi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in məktubu onlara verildi. Qureyş bir müddət Osmanı həps etdi. Bu xəbər müsəlmanlara Osmanın öldürülməsi kimi çatdırılır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu xəbəri eşidən kimi: «Bu adamlarla hesablaşmadıqca buradan getməyəcəyik» deyə buyurdu. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – müsəlmanlardan beyət etmələrini tələb etdi. Ağac altında Ridvan beyəti oldu. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bir əlini qaldıraraq buyurdu: «Bu da Osmanın beyəti». ***«And olsun ki, ağac altında sənə beyət edərkən Allah möminlərdən razı olmuşdur».*** *(Fəth 18).* Bunu eşidən müşriklər müqavilə bağlamaq üçün Suheyli göndərirlər. Bu müqavilədə Suheyl b. Amr Peyğəmbər –

---

[840] «əl-Luluu vəl Mərcan» 1540, Buxari, Müslim, Əhməd 1, Tirmizi 3096.
[841] Buxari 3905.

*sallallahu aleyhi və səlləm* – in yanına gəlib: «Gəl bizimlə sizin aranızda (on illik) sülh müqaviləsi bağlayaq!» Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – katibi (Əli b. Əbu Talib - *radıyallahu anhu* – nu) yanına çağırıb müqaviləni yazmağı ona əmr edib buyurdu: «Yaz! Rəhimli və Mərhəmətli Allahın adı ilə ***Bismilləhir-Rahmənir-Rahim***» Suheyl b. Amr: «O, ki, qaldı Rahmənə, Allaha and olsun ki, mən onu tanımıram! Biz bir vaxtlar yazdığımız kimi «Allahım! Sənin adın ilə başlayıram ***Bismikə Allahummə*** yaz!» dedi. Bu vaxt müsəlmanlar: «Allaha and olsun ki, biz yalnız ***Bismilləhir-Rahmənir-Rahim*** yazacağıq!» deyə etiraz etdilər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – katibinə əmr edərək: «Yaz! Allahım sənin adınla başlayıram! Bu Allahın elçisi Muhəmmədin bağladığı sülh müqaviləsidir!» Suheyl yenə etiraz edərək: «Əgər biz sənin Allahın elçisi olduğunu etiraf etsəydik Onun evini ziyarət etməyə sənə mane olmazdıq və səninlə müharibə etməzdik. Elə isə yaz – Muhəmməd b. Abdullah!» dedi. Peyğəmbər: «Baxmayaraq ki, siz məni təkzib edirsiniz, amma Allaha and olsun ki, həqiqətən mən Allahın elçisiyəm!». Katibinə əmr edərək: «Muhəmməd b. Abdullah» yazmağı əmr etdi. (Başqa rəvayətdə: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əli - *radıyallahu anhu* – ya: «Rəsulullah – sözünü silməyi əmr etdi». Əli: «Xeyr, Vallahi onu silməyəcəyəm!» dedi. Bu dəfə Peyğəmbər: «Onun yerini mənə göstər!» deyə buyurdu. Peyğəmbər öz əli ilə oranı silərək «İbn Abdullah!» sözünü yazdırdı).

Zuhri deyir ki: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Suheylin dedikləri ilə razılaşdı, çünki o: «Nəfsim əlində olana (Allaha) olsun ki, müşrüklər Allahın haram buyurduqlarına əməl etməklə məndən hər nə istəsələr onlara istədiklərini verəcəyəm!» deyə söz vermişdir». Sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ona ilk şərtini təklif edib buyurdu: «Allahın evini təvaf etməkdə bizə əngəl törətməyəcəksiniz!». Suheyl: «Xeyr! Allaha and olsun ki, bu dəfə təvaf etməyə sizə izn verməyəcəyik. Çünki ərəblər: «Müsəlmanlar bizim müqavimətimizi qırdılar və bizi məcbur etdilər» deyə şayələr buraxacaqlar. Elə isə gələn ildən etibarən istədiyiniz qədər Allahın evini ziyarət edə bilərsiniz!» dedi. Əli - *radıyallahu anhu* – onun dediklərini yazdı. Sonra Suheyl ikinci şərti təklif edib: «Bizim tərəfdən sənin yanına gələn hər bir adamı hətta sənin dinini qəbul etsə belə geri qaytarmalısan!» dedi. Müsəlmanlar heyrətlə: «Subhənəllah! Müsəlman olub yanımıza gələn bir kimsə müşriklərə qaytarıla bilərmi?!». Onlar bu məsələni müzakirə edərkən Əbu Cəndəl b. Suheyl b. Amr - *radıyallahu anhu* – ayaqları qandallanmış vəziyyətdə onların yanına gəldi. (Əbu Cəndəl - *radıyallahu anhu* – İslam dinini qəbul etdiyi üçün Məkkəlilər onu həbs etmişdilər). O, Məkkənin aşağısında həbs olunduğu yerdən qaçmış və nəhayət özünü müsəlmanlara çatdırmışdır. Bu vaxt Suheyl: «Ey Muhəmməd! Bu müqavilənin ilk maddəsinə əsasən onu mənə qaytarmalısan!» dedi. Peyğəmbər: «Biz hələ müqaviləni tamamlamamışıq!». O: «Allaha and olsun ki, belə olduğu təqdirdə mən də sənin heç bir təklifinlə razı olmayacağam!». Peyğəmbər: «Sən Əbu Cəndəl - *radıyallahu anhu* – nu bu müqavilədən istisna et və onu mənə bağışla!» O: «Mən onu qoyduğumuz şərtdən istisna edib sənə bağışlaya bilmərəm!». Peyğəmbər: «Sən gəl razı ol, onu mənə bağışla!» Suheyl qətiyyətlə rədd edib: «Mən heç cür sənin dediyinə əməl edə bilmərəm!». Bu zaman Mikrəz dedi: «Onu özünüzdə saxlamağa sənə icazə verdik!» (Müqavilə bağlayan Suheyl isə buna razılıq vermədi). Əbu Cəndəl: «Ey müsəlman cəmaatı! Artıq müsəlman olub sığınacaq tapmaq üçün sizin yanınıza gəldim. İndi də

[842] Bu müqavilə yalnız iki il davam etmişdir. Fəthul Bəri 5/404.
[843] Müqaviləni imzalayan Suheylin oğludur.

məni müşriklərə təhvil verirsiniz? Mənim əzab-əziyyətlərə məruz qaldığımı görmürsünüzmü?» dedi. O, Allah yolunda müşriklərin çox ağır işkəncələrinə məruz qalmışdı. Ömər b. əl-Xəttab - *radıyallahu anhu* – deyir ki, o zaman mən gəlib Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dedim: «Məgər sən Allahın haqq Peyğəmbəri deyilsənmi?» O: «Bəli!» deyə cavab verdi. Mən dedim: «Məgər biz haqq yolunda, düşmənlərimiz isə batil yolda deyillərmi?» O: «Bəli!» deyə cavab verdi. (Başqa rəvayətdə: «Məgər bizim ölülərimiz Cənəttdə, onların ölüləri Cəhənnəmdə deyilmi?» O: «Bəli!» deyə cavab verdi). Mən: «Elə isə nə üçün nöqsan və qüsurların dinimizə daxil olmasına imkan verməliyik?» deyə soruşdum. O: «Həqiqətən mən Allahın elçisiyəm və heç vaxt Ona asi olmuram! Məhz Allah mənə yardım edir!» deyə cavab verdi. Mən: «Məgər sən bizə «Bu yaxınlarda Allahın evinə gedib onu təvaf edəcəyik!» deyə xəbər verməmişdinmi? O: «Elədir! Məgər mən sənə məhz bu il təvaf edəcəyimizi xəbər vermişdim?» deyə cavab verdi. Mən: «Xeyr!» deyə cavab verdikdə o, buyurdu: «(Yaxın zamanlarda) Sən mütləq gedib Kəbəni təvaf edəcəksən!»

Sonra mən Əbu Bəkr - *radıyallahu anhu* – nun yanına gəlib dedim: «Məgər bu adam Allahın haqq Peyğəmbəri deyilmi?» O: «Bəli, elədir!» deyə cavab verdi. Mən: «Məgər biz haqq yolunda, düşmənlərimiz isə batil yolda deyillərmi?» O: «Bəli, elədir!» deyə cavab verdi. Mən: «Elə isə nə üçün nöqsan və qüsurların dinimizə daxil olmasına imkan verməliyik?» deyə soruşdum. Əbu Bəkr - *radıyallahu anhu* – dedi: «Ey insan! Həqiqətən o Allahın elçisidir və heç vaxt Rəbbinə asi olmur! Allah onun yardımçısıdır. Elə isə onun sünnəsindən yapış (əmr və qadağalarına riayət et!) Allaha and olsun ki, o haqq üzərindədir!» deyə cavab verdi. Mən: «Məgər o bizə «Bu yaxınlarda Allahın evinə gedib onu təvaf edəcəyik!» deyə xəbər verməmişdimi?» O: «Bəli, elədir. Məgər o sənə məhz bu il təvaf edəcəyini xəbər vermişdi?» deyə soruşdu. Mən: «Xeyr!» deyə cavab verdikdə o, dedi: «(Yaxın zamanlarda) Sən mütləq gedib Kəbəni təvaf edəcəksən!» (Başqa rəvayətdə: «Bu hadisədən sonra Fəth surəsinin ayələri nazil oldu. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dərhal Ömər - *radıyallahu anhu* – ya xəbər göndərdi və bunu ona oxudu!». Ömər: «Ya Rəsulullah! Fəth budurmu? Deyə soruşdu. Peyğəmbər: «Bəli!» deyincə Ömərin qəlbi rahatlandı). Zuhri xəbər verir ki, Ömər - *radıyallahu anhu* – dedi: «Bu əməlimdən sonra (kəffarə olaraq) bir çox xeyirli işlər görmüşdüm» .

**16. *Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – İn İştirak Etdiyi Döyüşləri Bilmək:***

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – **27**, bəzi mənbələrə görə **29** döyüşdə iştirak edib. Bunlardan yalnız **9-**da özü şəxsən döyüşmüşdür .

***Ficar –*** döyüşü Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – **20** yaşında ikən Qureyş və Kinanə ilə Qeys və Aylan qəbilələrinin arasında Ukaz bazarında bir döyüş olmuşdur. Bu döyüşdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – iştirak etmiş və əmilərinə ox hazırlamaqda kömək etmişdir. Sonra isə iki tərəf arasında barış olmuşdur.

***Bədr*** – hicri **2**-ci ildə Ramazan ayının **27**-si Cümə günündə olmuşdur. Müsəlmanlar **313-319** mücahid ilə **950-1000** nəfərlik düşmənə qarşı vuruşub qalib gəlmişlər. Bu döyüşdə **82-86** Mühacir, **61** Əus və **170** nəfər Həzrəc qəbiləsindən iştirak edirdilər. Bu döyüşdə müşriklər **70** ölü və **70** əsir verirlər. Əsir alınanlar içərisində Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in əmisi Abbas, qızı Zeynəbin əri Əbul As b. əl-Rabi,

---

[844] Buxari 2731, Müslim 1783.
[845] Buxaridə gələn rəvayətdə **19** döyüşdə iştirak etdiyi bildirilir 3949.

Əlinin qardaşı Ukayl b. Əbu Talib, Əbu Sufyanın oğlu Amr və s. olur. Məkkədən **150** km aralıda yerləşən quyuların adı idi. Bəzi rəvayətlərə görə o, ərazinin sahibi Bədr b. Kəlbə olduğu üçün onun adından götrülmüşdür. Bu döyüşdə təkbətək döyüşmək üçün ənsarlardan üç nəfər irəli çıxır. Bunlar Rəvaha, Auf b. Məlik və Muavis b. Arfa olur. Lakin müşriklər buna etiraz edərək deyirlər ki, bizə Qüreyşdən döyüşçülər lazımdır. Bu vaxt Əli, Həmzə və Ubeydə irəli çıxır. Müşriklərdən isə Valid b. Utbə, Utbə b. Rabi və Şeybə b. Rabi irəli çıxır. Üçüdə öldürülür. Müsəlmanlardan isə Ubeydə yaralanır. Bu döyüşdə **14** şəhid verilir. Döyüşdə həmçinin Əbu Cəhl də qətlə yetrilir. Onu öldürən Arfənin iki oğlu Muaz b. Arfə və Muaz b. Amr əl-Camuxdur . Bu döyüşdə mələklər də müsəlmanlara kömək edirlər. İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Bədr günü Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Baxın Cəbrail – *əleyhissəlam* – öz silahı ilə atının yüyənindən tutub» . Rifa b. Rafi əz-Zurani - *radıyallahu anhu* – rəvayət edir ki, Cəbrail – *əleyhissəlam* – Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Siz Bədr döyüşündə iştirak edənləri nə sayırsınız». (Peyğəmbər) buyurdu: «Müsəlmanların ən xeyirliləri». Cəbrail – *əleyhissəlam* – dedi: «Mələklərdən də Bədr mələkləri belədir» .

***Kaynuka*** **-** Yəhudilər müsəlmanları ələ salırdılar. Buna görə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – yanlarına gedərək onlara nəsihət edir. Lakin bu nəsihət Yəhudiləri daha da qızışdırır və onlar Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dedilər: «Bax ey Muhəmməd! Döyüşün nə olduğunu bilməyən bir topluluğa qalib gəlməyin səni aldatmasın! Bizim üstümüzə gəlsən kim olduğumuzu bilərsən». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onların bu sözlərinə səbr etdi. Lakin bundan sonra baş verən hadisə artıq səbrin tükənməsi demək idi. Yəhudilər bazarların birində alış-veriş edən bir qadının örtüyünü açaraq onu ələ salmağa başladılar. Yardıma gələn müsəlmanlardan biri orada olan Yəhudilərdən birini öldürdü. Yəhudilər də toplanaraq o, müsəlmanı şəhid etdilər. Bu hadisə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – çatdıqda H. **2**-ci ili Şəvval ayının **15** Kaynuka oğulları Yəhudilərini mühasirəyə aldı. Mühasirə **15** gün davam etdi. Zil Hiccə ayının ilk günləri Yəhudilər təslim oldular. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onları Mədinədən çıxardaraq Suriya bölgəsinə göndərdi.

***Bəni Səlim*** **–** Qatafan və Səlim qəbilələrinin ittifaq bağlayaraq Mədinəyə hücum etmək xəbəri Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – çatır. **200** nəfərlik bir dəstə toplayaraq hücum edir. Şam və Məkkə yolu üzərində bədəvilərin toplandığı ***Karkaratul Kədir*** deyilən yerə çatır. Bu xəbəri eşidən bədəvilər isə **500** dəvə buraxaraq qaçırlar. H. **2** Şəvval ayında baş vermişdir.

***Zu Amr Və Bahran*** **–** döyüşləri də bu qəbilələrin Bəni Səlim və Bəni Muharib qollarına qarşı olmuşdur. Onların da hücum xəbərini aldıqda Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dəstə düzəldərək hücum etmiş. Lakin düşmən bu xəbəri eşidəcək qənimət buraxaraq qaçmışdılar.

***Suvayk*** **–** döyüşü Bədr döyüşündən sonra baş vermişdir. Əbu Sufyan bu məğlubiyyətdən sonra and içmişdir ki, Muhəmmədə qalib gəlmədikcə başıma su tökməyəcəyəm. **200** Qureyşli ilə yola çıxır. Mədinə yaxınlığında əl-Arid adlanan yerə qədər gəlir. Yolda qarşılarına çıxanları öldürür və mal-qaraya da ziyan vururdular. İki

---

[846] Buxari 3141, 3926.
[847] Buxari 3995.
[848] Buxari 3992.

müsəlmanı da öldürdükdən sonra Məkkəyə geri dönürlər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu xəbər çatır. Onları tutmaq üçün yola düşürlər. Lakin müşriklər qaçmışdılar. Müşriklər yağda qovrulmuş Suveyk adlanan yeyəcəklərini və digər yüklərini də atmışdılar. Buna görə də bu döyüşə Suveyk döyüşü adı verilmişdir. Müsəlmanlar onları təqib edirlər. Çatmayacaqlarını başa düşdükdə geri dönürlər. Bu döyüş Bədr döyüşündən iki ay bir neçə gün sonra baş vermişdir H. **2** Zil Hiccə ayı.

***Uhud*** - hicri **3**-cü ildə Şəvval ayının **6** Cümə günü baş verir. Müsəlmanlar **1000**, müşriklər isə **3000** nəfərə yaxın olurlar. Səhl b. S d - *radıyallahu anhu* – rəvayət edir ki, bizə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yarasından danışarkən bunları söylədi: «Allaha and olsun ki, mən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yarasını kim yuyurdu, onun üzərinə kim su tökürdü və nə ilə müalicə edilirdi? Bunların hamısını bilirəm. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in qızı Fatimə - *radıyallahu anhə* – onun qanını silir, Əli - *radıyallahu anhu* – qalxanı ilə daşıdığı suyu tökürdü. Fatimə - *radıyallahu anhə* – suyun qanın qarşısını kəsmədiyini gördükdə həsirdən bir az götürərək yandırdı və külünü yaraya basdı. Bundan sonra qan kəsildi. (Bu döyüşdə) onun ön dişi qırılmış, üzü yaralanmış, başında olan miğfəri isə qırılmışdı» . Bu döyüşdə Utbə b. Əbu Vaqqas daş ataraq Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in dişini sındırır, alt dodağını yaralayır. Sad b. Əbu Vaqqasın qardaşı idi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onun üçün dua edərək deyir ki, ilinə qalmasın. Həqiqətən də il keçməmiş ölür. Abdullah b. Kaima da qılıncı ilə yanağını yaralayır. O, sonra vəhşi bir heyvan tərəfindən parçalanaraq öldürülür. Bu döyüşdə həmçinin Həmzə – *radıyallahu anhu* – da şəhid edilir. Onu Mutim b. Cubeyrin köləsi Vəhşi b. Hərb öldürür. Onu öldürməyin müqabilində azad edəcəyini söz vermişdi. Çünki Həmzə – *radıyallahu anhu* – Bədr döyüşündə onun əmisi Tuaymə b. Adiyi öldürmüşdür . Həmçinin bu döyüşdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in öldürüldüyü xəbəri də yayılır. Bəra b. Azim – *radıyallahu anhu* – rəvayət edir ki, (Uhud) döyüşündə müşriklərlə qarşı-qarşıya gəldik. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – məharətli ox atıcılarından (əlli nəfərlik) bir qrup əskəri ayıraraq başlarına da Abdullah b. Cubeyr – *radıyallahu anhu* – təyin etdi. Ona: «Bir an belə yerinizdən tərpənməyin. Hətta bizim onlara qalib gəldiyimizi görsəniz də belə yerinizdən tərpənməyin. Onların bizə qələbə çaldıqlarını (və quşların cəsədlərimizi diddiklərini) görsəniz də belə (mən sizə adam göndərmədikcə) bizə yardıma gəlməyin» deyə buyurdu. Müşriklərlə qarşılaşdığımız zaman (Allah onları məğlubiyyətə uğratdı) və onlar qaçmağa başladılar. Hətta dağa doğru ətəklərini toplayaraq qaçan qadınları da gördüm. (Ayaq biləklərində olan) halqaları da belə görsənirdi. Bizimkilər belə deməyə başladılar: «Qənimət! Qənimət!» İbn Cubeyr: «Pəyğəmbər – *sallallahu aleyhi və səlləm* – sizə nə dediyini unutdunuzmu? Yerlərinizi tərk etməyin!» deyə tənbeh etdi. Oxçular onun sözünü dinləməyərək: «(Vallahi biz də qardaşlarımızın yanına gedib qənimətdən götürəcəyik)» dedilər. Onlar bu əmrə etiraz edincə üzləri tərs çevrildi. (Nə edəcəklərini bilməyən dəlisovlara döndülər) və məğlub oldular (Xalid b. Vəlid oxçuların Rima təpəsini tərk etdiklərini gördükdə ora hücum edir və təpəni ələ keçirir). **70** şəhid verildi. Pəyğəmbər – *sallallahu aleyhi və səlləm* – təpənin üzərində İbn Cubeyr – *radıyallahu anhu* – ilə qalan (**12**) nəfəri geri çağırdı. Gecə düşdükdə Əbu Sufyan üç dəfə səsləyərək: «Aranızda Muhəmməd varmı?» deyə soruşdu. Peyğəmbər:

[849] Buxari.
[850] Buxari 4072.

«Ona cavab verməyin» deyə buyurdu. Əbu Sufyan təkrar üç dəfə səsləyərək: «Aranızda Əbu Kuhafə varmı?» deyə soruşdu. Peyğəmbər yenə də: «Ona cavab verməyin» deyə buyurdu. Əbu Sufyan yenə də üç dəfə səsləyərək: «Aranızda Xattabın oğlu varmı?» deyə soruşdu. Heç kimsə ona cavab vermədi. Bundan sonra Əbui Sufyan: «Onlar hamısı öldürüldülər. Əgər sağ olsalardı cavab verərdilər» dedi. Bu sözlərdən sonra dözə bilməyən Ömər: «Ey Allahın düşməni yalan söylədin. Allah Rəsulu da, Əbu Bəkr də və mən də burdayıq və sağıq» dedi. Əbu Sufyan: «Savaş bir rəqabətdir. Günə gün! (Uhud Bədrə qarşılıqdır)» dedi və: «Şanın uca olsun ey Hubel! «. Peyğəmbər: «Ona cavab verin» deyə əmr etdi. Səhabələr: «Nə deyək?» deyə soruşdular. Peyğəmbər: «Allah ən uca və ən üstündür» deyə buyurdu. Əbu Sufyan: «Bizim Uzzamız var, sizin isə Uzzanız yoxdur» dedi. Peyğəmbər: «Ona cavab verin» deyə əmr etdi. Səhabələr: «Nə deyək?» deyə soruşdular. Peyğəmbər: «Allah bizim Mövlamızdır, sizin isə Mövlanız yoxdur» deyə buyurdu. Əbu Sufyan: «Həqiqətən də siz öz ölülərinizin içindən tanınmaz hala salınmış kimsələri tapacaqsınız. Bunu mən əmr etmədim, lakin bu məni heç də məyus etmədi. Məni pisləməyin». Peyğəmbər: «Ona cavab verin» deyə əmr etdi. Səhabələr: «Nə deyək?» deyə soruşdular. Peyğəmbər: «Bizim ölülərimiz Cənnətdə, sizinkilər isə Cəhənnəmdədir» deyin . Həmçinin bu döyüşdə də mələklər müsəlmanlara yardım göstərmişlər. Səid b. Əbu Vaqqas – *radıyallahu anhu* – rəvayət edir ki, Uhud günü mən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – iki ağ əbada olan kimsə ilə gördüm. Böyük sücayət göstərərək (onu) qoruyurdular. (Mən) onları nə bundan əvvəl görmüşdüm, nə də (döyüşdən) sonra görə bildim. .

***Hamraul Əsəd*** – döyüşü Uhud döyüşündən dərhal sonra baş vermişdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu döyüş üçün yalnız Uhudda iştirak edənlərin toplanmasını əmr edir. Mədinəyə **8** mil məsafədə Hamraul Əsəd adlanan yerə gəlirlər. Müşriklər isə Mədinəyə **36** mil məsafədə olan Rəvha bölgəsinə gəlirlər. Huzaə qəbiləsinin ağası Məbəd b. Mabəd təzə müsəlman olmuşdur. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəlir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ona təlimat verir ki, Əbu Sufyanın yanına gedərək onu qorxutsun. O, da Əbu Sufyanın yanına gedərək deyir: «Müsəlmanlar sizinlə qarşılaşmaqda israrlıdırlar. Bərabərində görünməmiş bir qüvvəsi vardır». Bu sözlər müşrikləri qorxuya salır və onlar geri dönürlər.

***İkinci Bədr*** **–** döyüşü Uhud döyüşündən bir il sonra H. **4** ili Şaban ayında Əbu Sufyan Bədrdə görüşmək üçün müsəlmanlarla sözləşdilər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Abdullah b. Rəvaha – *radıyallahu anhu* – nu Mədinədə naib təyin edərək **1500** nəfərnən Bədrə gəldi. Bayrağdar Əli – *radıyallahu anhu* – idi. **10** nəfərlik bir süvariləri də var idi. Əbu Sufyan Qorxu içində idi. Lakin **2000** döyüşçü və **500** süvari ilə Bədrə gəlir. Əbu Sufyan orduya: «Ey Qureyş topluluğu bolluq olan bir ildə gələrik. Heyvanlarınızı otladıb, südlərindən içmiş olarsınız. Bu ili quraqlıqdır. Mən geri dönürəm siz də dönün» deyib geri dönürlər.

***Xəndək*** **–** H. **5**-ci il (bu döyüşə həmçinin də Əhzab (dəstələr) döyüşü də deyilir). Salman Farisinin təklifi ilə xəndəklər qazılır. Qureyş Əbu Sufyanın başçılığı ilə **300** süvari, **1000** dəvə, **4000** nəfərlik bir ordu ilə gəlmişdilər. Bundan başqa Qatafan və

---

[851] Bəni Kinanə qəbiləsinin ibadət etdikləri bütün adıdır. Kəbədə yerləşirdi.
[852] Buxari 3039, Təfsir Ali İmran 10, Məğazi 9,17,20, Əbu Davud 2662.
[853] Buxari 4055.

onlara tabe olan digər Nəcd qəbilələri **6000** nəfərlik bir ordu ilə Uhud dağının Bathan vadisinin Kanat bölgəsində ordularını qurdular. ***«O, zaman onlar üstünüzə həm yuxarı, həm də aşağı tərəfdən hücum etmiş və** (qorxudan) **gözünüz hədəqəsin-dən çıxıb ürəyiniz ağzınıza gəlmişdir. Allah barəsində də müxtəlif fikirlərə düşmüşdünüz. Məhz onda** (Xəndək vuruşunda) **möminlər imtahana çəkilmiş və möhkəm sarsılmışdılar. Möminlər ordu hissələrini gördükdə dedilər: Bu Allah və Rəsulunun bizə olan vədidir. Allah və Rəsulu düz buyurmuşlar. Bu onların yalnız** (Allaha) **imanını və itaətini artırdı».*** *(əl-Əhzab 10,11,22).*

***Bəni Qureyzə*** – döyüşü dərhal Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Xəndək döyüşündən döndükdən sonra Cəbrail – *əleyhissəlam* **-** gələrək ona Qureyzə Yəhudilərinin üzərinə yürüməsini əmr etdi. Ummu Məktub – *radıyallahu anhu* – Mədinədə naib buraxıldı. Ordu hazırlandı və yola düşdülər. İslam ordusunun bayrağdarı Əli – *radıyallahu anhu* – idi. Qureyzə Yəhudiləri öz qalalarına çəkilmişdilər. **25** gün mühasirədə qaldıqdan sonra aclıqdan təslim oldular. Burada əsirlərin öldürülüb öldürülməməsi xüsusunda Sad b. Muaz – *radıyallahu anhu* – hökm verir: «Kişiləri edam olunacaq, qadınları və uşaqları əsir alınacaq və malları da müsəlman əskərləri arasında paylanacaqdır». Sadın bu hökmündən sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ona: «Ey Sad! Sən yeddi qat göylərin üstündən enən Allahın verdiyi hökmlə hökm verdin» deyə buyurdu. Dərə qazılır və öldürülərək ora atılır. Qureyzə Yəhudilərinin sayı **400** (**600**) deyilir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – əsirlər arasında Zeyd b. Amrın qızı Reyhanəni alır və onu azad edərək evlənir.

***Bəni Mustələq*** **–** Huzaə qəbiləsinin bir qolu idi. Huzaə qəbiləsi Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – kömək göstərərkən bunlar Qureyşə köməklik göstərirdilər. Xəbər çatır bu qəbilə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – üzərinə hücum etmək istəyir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – xəbərin doğru olub olmadığını yoxlamaq üçün Bureydə b. Həsibi göndərir. O, da xəbər gətirir ki, hücuma hazırlaşırlar. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Mədinəyə Zeyd b. Hərisi – *radıyallahu anhu* – nu naib buraxaraq döyüşə yollanır. **700** nəfər ilə. Mustələq orduları sahil boyu Fədid bölgəsində Mureysi adlanan bir suyun ətrafında toplanmışdılar. H. **6** Şaban ayında gecə vaxtı ani bir hücum ilə onların üzərinə hücum edərək hamısını məhv edirlər. Əsirlər arasında Mustələq qəbiləsinin başçısı Həris b. Əbi Dırarın qızı Cuveyriyyə də var idi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Mədinəyə qayıtdıqda onu azad edir və İslamı qəbul etdikdən sonra onunla evlənir.

***Xeybər*** **–** H. **7**-ci ili Məhərrəm ayında Hudeybiyyə sülhündən sonra baş verir. (Bu sülh müqaviləsi isə **628**-ci il Mart ayında Məkkə yaxınlığında Hudəybiyyə vadisində baş verir. Bu müqavilədə iştirak edənlərin sayı **1400, 1500** nəfər olur. Səmura ağacının altında Ridvan beyəti olur). Döyüşdə iştirak edənlər Mədinəyə naib olaraq Suba b. Arfatə əl-Ğiffari olur. Ridvan beyətində beyət etmiş **1400** nəfər olur. Xeybər qalası üç tərəfdən möhkəm qalalarla əhatə olunmuşdur. Nata – Naim, Sab və Zubeyr qalaları, Kuteybə – Qamus, Vatim və Selalem, Şaq – Əba və Nəzzar qalaları. Biz Xeybərə çatdıqda düşmənlərin başçısı Mərhəb qılınc oynadaraq irəli çıxdı və:

***Qad Alimət Xeybəru Ənni Mərhəb***
***Şəkissiləhi Bətalun Mucərrabu***
***İzəl Hurubu Əqbələt Tələhhəbu***
Artıq Xeybər tanıdı, bildi ki, Mərhəbəm mən!
Müharibə başlayıb, döyüş alovlanarkən,

Mahir silah ustası, təcrübəli ərəm mən!

Əmim Amir - *radıyallahu anhu* – onunla təkbətək döyüşmək üçün irəli çıxdı və:

***Qad Alimət Xeybəru Ənni Amiru***
***Şəkissiləhi Bətalun Muğamiru***

Artıq Xeybər tanıdı, bildi ki, Amirəm mən,
Mahir silah ustası, çevik qəhrəmanam mən!

Təkbətək döyüş başladı və hər ikisi bir-birinə qılınc ilə zərbələr endirməyə başladılar. Mərhəbin qılıncı Amirin qalxanına dəydi. Amir də onu alt nahiyədən vurduqda qılıncı özünə qayıdaraq qolunun damarını kəsdi. Amirin ölümü də bu yaradan oldu. Mən gördüm ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in səhabələrindən bir neçəsi: «Amirin cihad əməli batil oldu, o özü-özünü öldürdü!» deyə danışırdılar. Mən ağlayaraq Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəldim və: «Ey Allahın Rəsulu! Amirin cihad əməli batil olub boşa getdimi?» deyə soruşdum. Peyğəmbər: «Bunu kim iddia edir?» deyə buyurdu. Mən: «Səhabələrdən bəziləri» dedim. O: «Bunu söyləyən yalan demişdir! Əksinə o, ikiqat savab qazanmışdır!» deyə buyurdu. Sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – məni Əli - *radıyallahu anhu* – nu çağırmağa göndərdi. Əli - *radıyallahu anhu* – gözlərinin ağrısından əziyyət çəkirdi. Peyğəmbər: «Bu bayrağı (sabah) elə bir kimsəyə verəcəyəm ki, o Allahı və Rəsulunu sevir, Allah və Rəsulu da onu sevir!» deyə buyurdu. Mən Əli - *radıyallahu anhu* – nun yanına gəldim. Gözləri ağrıdığı üçün onun əlindən tutub Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gətirdim. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əli - *radıyallahu anhu* – nun gözlərinə tüpürərək dua etdi və onun gözləri dərhal sağaldı. Bayrağı ona verdi. Yəhudi Mərhəb irəli çıxaraq:

***Qad Alimət Xeybəru Ənni Mərhəb***
***Şəkissiləhi Bətalun Mucərrabu***
***İzəl Hurubu Əqbələt Tələhhəbu***

Artıq Xeybər tanıdı, bildi ki, Mərhəbəm mən!
Müharibə başlayıb döyüş alovlanarkən,
Mahir silah ustası, təcrübəli ərəm mən.

Onun sözlərinə cavab olaraq Əli - *radıyallahu anhu* – dedi:

***Ənnəlləzi Səmmətni Ummi Həydərah***
***Kələysi Ğabətin Kərihil Mənzarah***
***Ufhimu Bissai Kəyləssəndərah***

Anamın Heydər (aslan) adlandırdığı mənəm,
Meşələr aslanı tək zəhimli görkəmliyəm,
Düşmənləri pərən-pərən edib tez öldürərəm!

Şeri oxuyaraq döyüşə atıldı və Mərhəbin başından qılınc ilə vuraraq onu öldürdü. Bundan sonra Xeybər məhz Əli - *radıyallahu anhu* – nun iki əli ilə alındı . (Başqa rəvayətdə: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əli - *radıyallahu anhu* – nun gözlərini müalicə etdikdən sonra Əli: «Ya Rəsulullah! Xeybər Yəhudiləri ilə onlar da bizim kimi (müsəlman) olana qədər vuruşacağam» dedi. Peyğəmbər: «(Ey Əli!) Onların sahəsinə girdiyin zaman yavaş-yavaş yeri. Sonra onları İslama dəvət et və üzərilərinə vacib olan İslam əsaslarını onlara xəbər ver. Allaha and olsun ki, (ya Əli!) tək bir nəfəri sənin səbəbinlə Allah hidayətə yönəldərsə bu sənin üçün qırmızı

---

[854] Müslim 1807.

dəvələrdən də xeyirli olar!» deyə buyurdu . Bu qalaların hər birisi müsəlmanlar tərəfindən ələ keçrilir. Döyüş nəticəsində Yəhudilərdən **93** nəfər öldürülür, müsəlmanlardan isə **15** nəfər şəhid olur. Bu döyüşdə eşşək əti və siğə haram edilir. Bu döyüşdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – i bir yəhudi qadın zəhərləyir. Bundan sonra Fədək yəhudiləri də, Vadi Kura yəhudiləri də, Teymə yəhudiləri də Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə təslim olurlar.

***Zatur Riqa* –** döyüşü H. **7**, **626**-cı ilində Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Xeybərdən döndükdən sonra baş vermişdir. Enmar, Saləbə, Muharib oğullarının döyüş üçün toplandıqlarını xəbər aldıqda Mədinəyə Osman - *radıyallahu anhu* – nu naib təyin edərək **700** nəfərlik ordu ilə hərəkətə keçdi. Üzbəüz gələn ordular bir-birilərindən çəkindikləri üçün döyüşmədən geri dönürlər. Zatur Riqa adlanmasının səbəbi isə müsəlmanların ayaqlarını daşlar əzdiyi üçün ayaqlarına bezlər bağlamışdılar .

***Fəth* –** Məkkənin fəth edilməsinə bu hadisə səbəb olmuşdur. Hudeybiyyə sülhündən sonra Huzaə qəbiləsi müsəlmanlarla ittifaqa girmiş və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in himayəsinə girmişdilər. Bəkr oğulları isə Qureyşin himayəsinə keçmişdilər. Bu iki qəbilə arasında çoxdan bəri davam edən qan davası var idi. İslamın gəlməsi ilə yatan bu düşmənlik Hudeybiyyədən sonra yenə də baş qaldırdı. Bəkr oğulları gizlin olaraq gecə ilə Huzaə qəbiləsinə hücum edərək iyirmiyə yaxın adam öldürürlər. Qureyş bu işdə Bəkr oğullarına silah ilə dəstək olmuşdur. Qureyş bundan sonra etdiyi işə peşman olmuşdur. Dərhal Əbu Sufyan Mədinəyə gələrək barış istədi. İlk öncə qızı, möminlərin anası Ummu Həbibə - *radıyallahu anhə* – nin yanına gəldi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in döşəyində oturmaq istədi. Lakin Ummu Həbibə - *radıyallahu anhə* – həmən döşəyi çəkdi. Əbu Sufyan: «Balam! Döşəyi mənəmi yaraşdırmadın, yoxsa məni döşəyə yaraşdırmadın» dedi. Ummu Həbibə: «Bax, ata bu döşək Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə məxsusdur. Sən bütlərə ibadət etdiyin üçün pissən. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in döşəyində oturmağını istəmədim» deyə sərt cavab verdi. Oradan Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına getdi. Vəziyyəti ona izah etməyə çalışdı. Lakin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – heç bir cavab vermədi. Çarəsizlikdən ayrılaraq bu dəfə Əbu Bəkr, sonra Ömər, sonra isə Əli - *Allah onlardan razı olsun* - yanına gəldi. Lakin üçündən də eyni rədd cavabını aldı. Əbu Sufyan əliboş Mədinəni tərk etdi. H. **8**-ci ildə **10 1000** mücahid ilə Mədinədən çıxaraq Məkkəni fəth edir. İbn Qeyyim – *rahmətullahi aleyhi* - deyir ki: «Bu ən böyük fəthlə Allah, dinini, elçisini, ordusunu və hizbini əziz etdi. Aləmlərə hidayət etdiyi yerini və evini kafir və müşriklərin əlindən qurtardı. Bu göy əhlinin sevinci və müjdə duyduğu, insanların dəstə-dəstə Allahın dininə giriş qapıları açıldığı, yer üzünün aydınlıq və sevinclə gülümsədiyi bir fəthdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Rəhmanın ordusunu H. **8**-ci il Ramazan ayının **10**-cu günü hərəkətə keçdilər. Mədinədə yerinə Əbu Ruhm Gülsüm b. Hüseyn əl-Ğifarini, bəzi rəvayətlərə görə Ummu Məktubu buraxdı». Yola çıxdığı zaman oruclu idi. Lakin yolda oruclarını açırlar. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Məkkəyə savaşsız və müqavimətsiz girmək istəyirdi. Lakin Bədrdə iştirak edən müsəlmanlardan biri Xatib b. Əbi Bəlta – *radıyallahu anhu* – Məkkədə olan müşriklərdən bir qrupuna Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Mədinədən çıxması haqda bir qadın vasitəsilə məktub göndərir. Peyğəmbər – *sallallahu aleyhi və*

---

[855] Buxari «Xeybər döyüşü babı», Müslim 2406.
[856] Buxari 4128.

*səlləm* – Əli, Zubeyr və Miqdad (Allah onlardan razı olsun) bu qadının dalıyca göndərdi. Səhabələr məktubu götürərək Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəldilər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ey Xatib, bu nədir?». Xatib: «Ey Allahın Rəsulu! Mənim üstümə qəzəblənməkdə tələsmə, sənə başa salaram. Bilirsiniz ki, Qureyş arasında qohum-əqrabası olmayan birisiyəm. Onlardan da deyiləm, qəribəm. Səninlə olan mühacirlərin də orada əqrabaları vardır ki, onları mallarını və ailələrini qoruyurlar. Lakin mənim malımı və ailəmi orada qoruyacaq bir kimsə yoxdur. Ona görə də onlardan ailəmin qorunması üçün təminat almaq istədim. Yoxsa bu işi kafir olduğumdan, dindən döndüyümdən, İslama girdikdən sonra küfrə riza göstərdiyimdən dolayı etmiş deyiləm. Belə bir şey ağlımdan belə keçməyib». Peyğəmbər: «Bu adam sizə doğru söylədi» deyə buyurdu. Ömər: «Məni burax bu münafiqin boynunu vurum» dedi. Peyğəmbər: «Bədirdə iştirak edən səhabəni, nə bilirsən bəlkə də Allah Bədr əhlinə muttali olub buyurmuşdu: İstədiyinizi edin, Mən sizi bağışladım». Bundan sonra ayə nazil oldu: ***«Ey iman gətirənlər! Nə mənim düşmənimi, nə də özünüzün düşmənini dost tutun! Onlar sizə gələn haqqı inkar etdikləri halda siz onlarla dostluq edir, mehribanlıq göstərirsiniz. Siz Rəbbiniz olan Allaha iman gətirdiyiniz üçün onlar Peyğəmbəri və sizi*** *(Məkkədən)* ***çıxardırdılar. Əgər siz mənim yolumda və Mənim rizamı qazanmaq uğrunda cihada çıxmısınızsa*** *(Mənim düşmənlərimi dost tutmayın).* ***Siz onlarla gizlində dostluq edir, onlara sirr verirsiniz. Mən sizin gizli saxladığınız və aşkar etdiyiniz hər şeyi bilirəm. Sizdən kim bunu etsə o, şübhəsiz ki, haqq yoldan azmışdır».*** *(əl-Mumtəhinə 1)* . Mərruz Zəhrana gəldilər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – əskərlərə atəş yandırmalarını əmr etdi. Beləcə on min atəş yandırıldı. Bu arada Qureyş liderlərindən Əbu Sufyan, Həkim b. Hizam, Budeyl b. Varka yaxınlaşan İslam ordusu haqqında xəbər toplamaq üçün Məkkənin kənarına çıxdılar. Əbu Sufyan: «Ömrümdə belə bir işıqlı gecə, belə böyük bir ordu görməmişdim» dedi. Müsəlman əskərləri tərəfindən əsir alınırlar. Əbu Sufyan İslamı qəbul edir . Məkkədə **360** bütü sındırır. ***«Haqq gəldi batil yox oldu. Çünki batil yoxluqa məhkumdur»****(əl-İsra 81).*

***Huneyn* –** H. **8-**ci il Şəvval ayının **6-**sı Məkkənin fəthindən **16** gün sonra. Həvazin (başçıları Malik b. Afv), Səkif və Bəni Nasr (başçıları Dureyd b. Simmə) qəbilələri birləşərək belə qərara gəlirlər ki: Muhəmmədin ordusu bizə hücum etməzdən əvvəl bizlər onlara hücum edək». Bu döyüş üçün **12** minlik müsəlman ordusu yığılmışdır. Müsəlmanların çoxluğunu görən bəzi səhabələr: «Bundan sonra bizlər əsla məğlub olmarıq» dedilər. Bu döyüşdə müsəlmanlar ilk olaraq məğlub olsalarda sonda Allah onlara zəfəri müyəssər etdi. Huneyndə məğlub olan müşriklər üç tayfaya bölündülər. Çox hissəsi Taifə sığındılar, bir qismi Nəhlə və bir qismi də Əvtasa sığınaraq döyüş halını aldılar. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əvtasa Əbu Musa əl-Əşarinin əmisi Amirin başçılığı ilə qoşun göndərdi ki, onlar da müşrikləri dağıdaraq əllərində olan malları da qənimət olaraq götürdülər. Bir dəstə müsəlman da Nəhlə qaçan müşrikləri də təqib edərək onları da dağıtdılar.

***Taif* -** Malik b. Afvın başçılığı ilə müşriklər Taif qalasına sığındılar. Yanlarında da bir il onlara bəs edəcək qədər ərzaqları da var idi. Müsəlmanlar qalanı mühasirəyə aldılar. **20** gün davam edən mühasirə heç bir xeyir gətirmədi. Bundan sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dua edərək: «Allahım! Sakiflərə hidayət ver və onları

---

[857] Buxari 7/592.
[858] Buxari 7/597-598.

bizə müsəlman olaraq gətir». Kim qaladan çıxaraq İslamı qəbul edərsə o, kimsə azad buraxılacaq əhli-əyalı ilə birlikdə. Bir müddətdən sonra Həvazin, Sakif tayfaları gələrək İslamı qəbul etdilər və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onlara toxunmayıb azad etdi.

***Təbuk*** – Mutə döyüşündə məğlub olmuş Rumlular çox məyus olmuşdular. Buna görə də yenidən qüvvələrini səfərbəy edərək toplandılar. Bu xəbər müsəlmanlara çatdı. Döyüşə hazırlıq başlandı. Əbu Bəkr - *radıyallahu anhu* – bütün malını gətirərək Allah yolunda verdi. Peyğəmbər: «Bəs ailən üçün nə saxladın?» deyə buyurdu. O: «Allah və Rəsulunun sevgisini» deyə cavab vermişdi. Eynilə Ömər - *radıyallahu anhu* – malının yarısını gətirmişdi. Həmçinin Osman - *radıyallahu anhu* – bu döyüş üçün **10** min dinar, **300** dəvə və **50** at vermişdi. Peyğəmbər: «Bu gündən sonra Osmana etdiyi heç bir şey zərər verməz» deyə buyurdu. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ailəsi üzərinə Əli - *radıyallahu anhu* – nu qoydu. Münafiqlər Əli - *radıyallahu anhu* – nu ələ salaraq: «Qocalar, qarılarla qalmısan» dəyə şayələr buraxdılar. Buna dözə bilməyərək Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəldərək: «Məni uşaqlar və qadınlarla buraxırsan?» dedi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ona: «Sənin mənə görə durumun Harunun Musaya görə durumu kimi olmasına razı deyilsən? Lakin məndən sonra heç bir Peyğəmbər gəlməyəcəkdir» bu sözləri deyərək geri göndərdi. Mədinədə Muhəmməd b. Məsləməni naib buraxaraq **3000** nəfərlə Təbuka doğru hərəkətə keçdi. İslam ordusunun böyük bayrağını Əbu Bəkr - *radıyallahu anhu* – ya verdi. Müsəlman ordusu Təbuka çatdılar. Lakin qarşılarına heç kəs çıxmadı. **20** gün orada qaldıqdan sonra geri qayıtmağı qərarlaşdırdılar. Bu döyüşdə həmçinin Kəb b. Məlik və iki Bədr də iştirak edən Murrə b. Rabia əl-Əşari və Hilal b. Umeyyə əl-Vəqifi - *Allah onlardan razı olsun* - üzürsüz olaraq döyüşə getməmələri hadisəsi də baş vermişdir. Bu döyüşə qatılmayan **80** yaxın adam Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gələrək üzürxaqlıqlarını bildirdilər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – də onların zahirinə baxaraq üzürxaqlıqlarını qəbul edib iç üzlərini Allaha həvalə edərək onlar üçün bağışlanma dilədi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – üç nəfərin doğru söylədiyini xəbər verərək onlarla Allahın əmri gəlincəyə qədər danışmamaq, salam verib almamaq əmrini verdi. Düz qırx gündən sonra Allah onlar barəsində ayə nazil edir və onların tövbələrinin qəbul olunduğunu bildirir: ***«Allah çətin saatda bir qisminin ürəyi*** *(şəkk-şübhəyə düşüb peyğəmbərdən və cihaddan)* ***dönmək üzrə ikən Peyğəmbərə, onun ardınca gedən mühacirlərə və ənsara tövbə nəsib etdi. Sonra Allah onlara qarşı şəfqətli və mərhəmətli olduğu üçün tövbələrini qəbul buyurdu. Həmçinin*** *(Təbuk döyüşündən)* ***geri qalmış üç nəfərin də*** *(tövbələrini qəbul etdi).* ***Belə ki, gen dünya onlara dar olmuş, ürəkləri*** *(qəm-qüssədən)* ***təngə gəlib sıxılmışdı. Onlar Allahdan*** *(Allahın əzabından)* ***yalnız onun özünə sığınmağın mümkün olduğunu başa düşdülər. Allah onlara tövbə etmək üçün tövbə nəsib etdi. Şübhəsiz ki, Allah tövbələri qəbul edəndir və rəhimlidir. Ey iman gətirənlər! Allahdan qorxun və*** *(imanında, sözündə, işində)* ***doğru olanlarla olun!».*** *(ət-Tövbə 117-119).*

***Zatul Sələsil*** – döyüşü Mutə döyüşündən bir ay sonra H. **8** ildə olmuşdur. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Şam ərəblərinin Roma ordularına qatılmasının qarşısını almaq və onları tərəfinə çəkmək üçün Amr b. əlAsın -

---

[859] Buxari, Müslim.

*radıyallahu anhu* – nun başçılığı ilə **300** nəfərlik ordu hazırladı. Lakin Şama gəldikdə onların çox olduğunu gördükdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən dəstək istədi. Əbu Ubeydə b. Cərrah - *radıyallahu anhu* – nun başçılığı ilə **200** nəfərlik heyyətdə göndərildi. İslam ordusu qalib gəldi. Sələsil Vadi Kurada bir suyun adı idi.

Bu döyüşlərdən dördündə mələklər müsəlmanlara kömək ediblər. Bədr, Uhud, Xəndək, Huneyn.

**17.** ***Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – İn İyirmi Üç İllik Peyğəmbərlik Həyatını Bilmək:***

Hira mağarasına çəkilib orada bir neçə vaxt ibadət etdikdən sonra **610**-cu ildə **40** yaşında ikən ona Peyğəmbərlik verilir . Peyğəmbərlik ona birinci gün verilir. Əbu Qatadə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən birinci gün oruc tutmaq haqqında soruşurlar. O, buyurur: «O, gün mən doğulmuşam, o gün mən insanlara göndərilmişəm və o, gün mənə ilk vəhy gəlib» . Allah onu bütün yaratdıqlarına göndərdi. Quran Ramazan ayında Qədr gecəsində dünya səmasına nazil olmuş, oradan da iyirmi üç il ərzində hissə-hissə endirilmişdir. ***«….Haqqı batildən ayıran Quran Ramazan ayında nazil edilmişdir».*** *(əl-Bəqərə 185)* . Həmçinin Yəhya Sərrasi «Nuniyə» adlı qəsidəsində deyir: «Peyğəmbərlik ona qırx yaşında gəldi, Elçilik günəşi Ramazan ayında parladı» .

**18.** ***Peyğəmbərliyin Necə Və Hansı Buyuruqla Ona Verilməsini Bilmək:***

***«Yoxdan yaradan Rəbbinin adı ilə oxu! O, insanı laxtalanmış qandan yaratdı. Oxu! sənin Rəbbin ən böyük kərəm sahibidir. O Rəbbin ki, insana qələmlə*** *(yazmağı)* ***öyrətdi. O Rəbbin ki, insana bilmədiklərini öyrətdi».*** *(əl-Ələq 1-5).* Bu buyuruqdan sonra ona Peyğəmbərlik verildi.

Vəhy Peyğəmbərimiz – *sallallahu aleyhi və səlləm* – bir neçə şəkildə gəlirdi. Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, bir gün Xaris b. Hişam - *radıyallahu anhu* – Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən: «Ya Rəsulullah! Vəhy sənə necə gəlir?» deyə soruşdu. Peyğəmbər: «Hərdən vəhy zınqırov səsi kimi gəlir. Bu da mənim üçün (vəhyin) ən ağır gəliş şəklidir. Deyilənləri öyrəndikdən sonra o, məni tərk edir. Hərdən də mələk mənim qarşıma insan qiyafəsində gəlir və vəhyi mənə çatdırır. Mən də onun dediklərini yadda saxlayıram. Aişə - *radıyallahu anhə* – deyir ki, mən görürdüm necə ki, soyuq bir havada vəhyin gəlişindən sonra onun alnından tər axardı» .

**1)** Həqiqi (doğru) yuxu - *Ruyai Sadiqa* – Bu Rəsullaha vəhyin ilk gəlməyə başladığı vaxdır. Bütün gördüyü yuxular sabah aydınlığı kimi həqiqət idi. **2)** Mələyin vəhyi qəlbinə salması, üfləməsi ilə . **3)** Mələk Rəsulullah – *sallallahu aleyhi və səlləm* – ə insan şəkilində gəlirdi . **4)** Vəhy zınqırov (zil) səsinə bənzər bir səslə gəlirdi. Bu vəhyin ən ağır şəkli idi. Mələk vəhyi o, qədər qarışıq, başadüşülməsi ağır bir şəkildə endirirdi ki, ən soyuq havada belə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in alnından tər damla-damla axırdı . Hətta səfər ərəfəsində miniyin üzərində olduqda

---

[860] Buxari, Müslim.
[861] Müslim.
[862] İbn Cərir 2/144, əl-Hakim «Mustədrək» 2/530, əs-Suyuti «Durrul Mənsur» 6/370.
[863] O, Şeyx Cəmaləddin Əbu Zəkəriyyə b. Yusif b. Yəhya olub Bağdadda doğulmuşdur. Gözəl dilçi və hafiz idi. Gözəl şer yazardı. Monqolların Bağdada girdikləri vaxt öldürüldü hicri 656. Şəzarat əl-Zəhəb 5/285,286.
[864] Buxari 2.
[865] Əbu Nuaym «əl-Hilyə» 3/156,157, 10/26,27 Əbu Uməmədən. Sənədində Ufeyr b. Miğdan zəifdir, qalan ravilər isə etibarlıdır. əl-Heysəmi «əl-Məcmua» 4/72, İbn Məcə 2144, İbn Hibban 1084,
[866] Buxari, Müslim.
[867] Buxari, Müslim, İmam Əhməd 6/158,163,257, Məlik 1/202, Nəsai 2/146,149 əl-İftitah.

belə bir vəhy gəlsəydi vəhyin ağırlığından heyvan yerə çökərdi . Bir dəfə vəhy gələn vaxt Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in dizi Zeyd b. Sabitin dizi üzərində idi. Zeydin ayağına o, qədər ağırlıq yuklənmişdir ki, az qala ayağı qırılacaqdır . **5)** Mələk yaradıldığı şəkildə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə görünürdü. Vəhy iki dəfə bu şəkildə endirilib. Maraqlananlar Nəcm surəsinin **7-13**-cü ayələrinə baxa bilərlər . **6)** Heç bir vasitə olmadan doğrudan-doğruya Allahın bildirdiyi vəhy. Merac gecəsində Allah namaz vaxtlarını bu şəkildə fərz qıldı . **7)** Üç Peyğəmbər var ki, Allah onlarla vasitəsiz danışmışdır. Adəm – *əlehissəlam* – ilə Cənnətdə, Musa – *əlehissəlam* – ilə yer üzündə və Muhəmməd – *sallallahu aleyhi və səlləm* – ilə Meracda. Bəziləri 8-ci vəhy şəkilini də deyirlər. Bu heç bir pərdə olmadan Allah ilə üz-üzə danışmasıdır. Bu merac gecəsində Rəbbini gördü deyənlərin rəyidir. Sələf və sonradan gələn İslam alimləri bu fikirdədilər ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – öz Rəbbini görməyib. Çünki səhabələr ondan soruşduqda ki, Allahı gördün o, buyurdu: «Bir nur gördüm» . Məsruk - *radıyallahu anhu* – deyir ki, Aişə - *radıyallahu anhə* – nin yanında dayanmışdım: «Ya Aişə! Üç şey vardır ki, hər kim onlardan birini söyləyərsə Allaha qarşı böyük iftira atmış olur. Nədir onlar?» dedim. Aişə: «Hər kim Muhəmməd Rəbbini gördü deyə söyləyərsə Allaha qarşı böyük iftira etmiş olur» dedi. Mən dayanmışdım. Həmən oturdum və: «Ey möminlərin anası! Bir dəqiqə. Tələsmə» dedim. Allah: ***«And olsun ki. Onu açıq üfüqdə görmüşdü»*** *(ət-Təkvir 23)* ***«O, qüvvət sahibi göründü. O*** *(Cəbrail)* ***ən uca üfüqdə idi». «And olsun ki, başqa bir dəfə də görmüşdü.*** *(yeddinci səmadakı)* ***Sidrətul-Muntəhanın yanında».*** *(ən-Nəcm 6-14)* deyə buyurmadımı? dedim. O: «O, Cəbraildi. Onu yaradılış surətində yalnız iki dəfə görmüşdü» dedi. Aişə: ***«Gözlər onu dərk etməz. O, gözləri dərk edər».*** *(əl-Ənam 103),* ***«Heç bir bəşər övladına Allahla danışmaq müyəssər olmaz. Allah onlarla ancaq vəhylə, yaxud*** *(Musa ilə)* ***pərdə arxasından danışar və ya bir elçi*** *(mələk)* ***göndərər, o da Allahın izni ilə Allahın istədiyini vəhy edər».*** *(əş-Şura 51)* .

**19.** ***Onunla Nələrin Göndərildiyini Və Nə Üçün Göndərildiyini Bilmək:***

Allahı tövhid etmək və əmr olunanları edib, qadağan olunanları tərk etməyi əmr edən şəriətlə göndərmişdir. Allah onu aləmlərə rəhmət olaraq, onları şirkin, küfrün və cəhalətin qaranlıqlarından elm, iman və tövhidin aydınlığına çıxartmaq üçün göndərmişdir. Bu yolla Allahın məğfirət və rizasına nail ola bilsinlər, onun əzab və qəzəbindən qurtara bilsinlər. Allah insanları şirkdən qorxudub əzabı vasitəsilə ayıltmaq, rububiyyət, uluhiyyət, isim və sifətlərində də tövhidə dəvət etmək üçün göndərmişdir. Bunlara dəlil: ***«Ey*** *(libasına)* ***örtünüb bürünmüş Peyğəmbər! Qalx*** *(qövmünü Allahın əzabı ilə)* ***qorxut! Öz Rəbbini uca tut. Libasını təmizlə. Əzaba səbəb olacaq pis şeylərdən uzaqlaş.*** *(Etdiyin yaxşılığı)* ***çox bilib başa qalxma. Rabbinin rizasını qazanmaq üçün səbr et».*** *(əl-Muddəssir 1-7).* Allahın ***«Qalx və qorxut»*** buyurduğunun mənası, şirkdən qorxudub çəkindirmək və tövhidə dəvət etmək deməkdir. ***«Öz Rəbbini üca tut»*** tövhid ilə onu təzim et. ***«Libasını təmizlə»*** yəni əməllərini şirkdən təmizlə. ***«Pis şeylərdən uzaqlaş»*** yəni bütlərdən uzaq dur. Onlardan uzaq durmaq isə bütləri və bütpərəstləri tərk edib, onlardan uzaq durmaq deməkdir.

---

[868] İmam Əhməd 6/118, Aişə - *radıyallahu anhə* – dən, əl-Həkim 2/505-də səhih demişdir. Zəhəbi də təsdiqləyir.
[869] Buxari «ət-Təfsir» 8/196.
[870] Müslim, Tirmizi 3274 Aişə - *radıyallahu anhə* – dən.
[871] Buxari, Müslim.
[872] Müslim.
[873] Müslim 177.

Bütün bu buyuruqlardan sonra ona risalət verilmiş oldu. O, da qalxıb dəvət etdi və Allahın əmrini yerinə yetirdi.

**20.** ***Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – İn Vəfatını Bildirən Əlamətlər:***

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in vəfatının yaxınlaşdığına işarə edən bir çox önəmli hadisələr və işarələr görülmüşdür.

1. Ummul Qura olan Məkkənin fəthi mübarək hicrətin **8**-ci ilində tamamlanmış, hicri **9**-cu ildə isə müsəlman olmaq və ya cizyə vermək üçün Mədinə şəhərinə axın-axın heyətlər gəlmişlər. Ərəb yarmadası bütünlüklə İslama boyun əydi. Bütün bunlar Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in və səhabələrinin **10** il boyunca sürdükləri cihadın bir meyvəsi idi. Artıq bütün bunlar Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – missiyasının sona gəldiyinə işarət edirdi.

2. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Muaz - *radıyallahu anhu* – nu Yəmənə göndərdiyi zaman ona bir çox tövsiyələr verdi. Tövsiyələrini bitirdikdən sonra buyurdu: «Ey Muaz! Ola bilər ki, sən bu ildən sonra məni görməyəsən. Sən qayıtdıqda artıq mənim məscidimə və qəbrimə çatacaqsan». Bu sözlər Muaz - *radıyallahu anhu* – nu hönkür-hönkür ağlatdı. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – üzünü Mədinəyə tərəf çevirərək: «İnsanlardan mənə ən layiq olanlar kim olursa olsun və harada olursa olsun müttəqilərdir» deyə buyurdu .

3. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – hər il Ramazan ayında on gün etiqafa çəkilərdi. Son ildə isə iyirmi gün etiqaf etmişdi. Cəbrail – *əlehissəlam* – hər il Quranı bir dəfə ona təkrar etdiyi halda son ildə iki dəfə təkrarlatdı.

4. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – hicrətin **10**-cu ilində Həcc etdi və buyurdu: «Həcci necə yerinə yetirəcəyinizi məndən öyrənin. Ola bilir ki, bu ildən sonra bir daha sizinlə görüşməyim. İnsanlarla vidalaşmağa başladı.

5. Ərafada bu ayə endi: ***«Bu gün dininizi kamil etdim və sizə olan nemətimi tamamladım. Bir din kimi sizin üçün İslamı seçdim».*** *(əl-Maidə 3).*

6. İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki: «Ömər - *radıyallahu anhu* – məni Bədrdə iştirak etmiş səhabələrlə birlikdə məclisə apardı. Bəziləri bundan xoşlanmayaraq: «Bunun bizim aramızda nə işi var. Bizim də onun kimi uşaqlarımız vardır» dedilər. Ömər - *radıyallahu anhu* – hansı səbəbdən onu bura gətirməsini izah etmək üçün sual verdi: «***İzə Cə Ənəsrullahi Vəl Fəth*** **–** haqqında nə bilirsiniz?». Onlardan bəziləri: «Bizə fəth müyəssər olub zəfərə çatdığımızda Allaha həmd edib günahlarımızın bağışlanmasını diləməklə əmr olunduq» dedilər. Digərləri isə heç bir söz də demədilər. Sonra mənə tərəf çönərək: «Ey Abbasın oğlu! Sən də mi belə deyirsən?» deyə soruşdu. Abbas: «Xeyr, bu surə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in əcəlidir. Allah ona əcəlinin çatdığını bildirərək buyurmuşdu: ***«Allahın yardımı və fəthi gəldiyi zaman…».*** *(ən-Nəsr).* Bu sənin əcəlinin yaxınlaşmasına işarədir. Belə ki, Rabbini təsbih edərək ondan məğfirət dilə. Çünki O, tövbələri qəbul edəndir». Ömər: «Mən də bunu sənin kimi anlayır və bilirəm» dedi .

7. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə vəhyin tez-tez gəlməsi. Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki: «Allah vəfatından əvvəl Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə tez-tez vəhy endirirdi. Lakin vəfat etdiyi günlərdə isə vəhy olduqca çoxalmışdır» .

---

[874] Əhməd 5/235. Məcmul Zəvaid 9/22.
[875] Buxari 10/606,607.
[876] Buxari 8/618, Müslim 18/102.

8. Əlamətlərdən biri də Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Uhuda getməsi və orada yatan şəhidlər üçün namaz qılmasıdır. Beləcə həm ölülərlə, həm də dirilərlə vidalaşırdı. Sonra minbərə çıxaraq: «Mən sizdən öncə gedəcəyəm və Vallahi bu an hövuzuma baxmaqdayam. Mənə yer üzünün xəzinələrinin açarları verilmişdir. Vallahi mən, məndən sonra şirk qoşmağınızdan qorxmuram, lakin dünya üçün bir-birinizlə yarışmanızdan qorxuram» .

9. Bu əlamatlərdən biri də bundan məhrum olmadan öncə insanları onu görməyə və məclisində olmağa insanları təşviq etməkdir. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Muhəmmədin nəfsi əlində olana and olsun ki, sizdən birinizin məni görməyəcəyi bir gün gələcəkdir. Məni görmək onun üçün bütün ailəsi və malından da sevimli olacaqdır» .

**21. *Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – İn Vəfatı:***

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu şəkildə hicrətdən sonra on il dəvət etdi. Allah onunla dini və möminlər üzərinə nemətini tamamladıqdan sonra, öz yanına və peyğəmbərlərin, siddiqlərin, şəhidlərin, salehlərin yaşadığı ən uca dostlar arasına qatılmaq üçün seçdi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Səfər ayının sonları ilə Rəbiul-Əvvəl ayının əvvəlləri xəstələndi. Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Bəqi qəbristanlığını ziyarət etdikdən sonra geri dönür. Məni rahatsız gördü: Çünki başım ağrıyır: «Vay başım, vay başım!» – deyirdim. O: «Ey Aişə! Əslində mən: «Vay başım» deməliyəm . Başını bağlamış halda müsəlmanların yanına, minbərə çıxdı. Şəhadət gətirdikdən sonra Uhudda öldürülən şəhidlərə məğfirət dilədi və buyurdu: «Allah qullarından bir qulunu dünya ilə nəzdində olanlar arasında sərbəst buraxdı, o da Allahın nəzdində olanları seçdi». Əbu Bəkr - *radıyallahu anhu* – bu sözlərin nə məna ifadə etdiyini başa düşdüyündən ağlamağa başladı və: «Anam, atam sənə fəda olsun». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yavaş ol, ey Əbu Bəkr! Şübhəsiz ki, dostluq və mal baxımından insanlar arasında mənə ən yaxın olanı sənsən. Rəbbimdən başqasını dost seçməli olsaydım, şübhəsiz ki, səni seçərdim, lakin İslamın dostluğu və sevgisi (bizi bir-birimizə) bağlamışdır. Əbu Bəkr - *radıyallahu anhu* – nu insanlara namaz qıldırmasını əmr etdi. Artıq namazları Əbu Bəkr - *radıyallahu anhu* – qıldırırdı ki, bu şəkildə toplam **17** vaxt namaz qıldırmışdır. Ömrünün son günləri və ya son günü Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – qızı Fatimə - *radıyallahu anhə* – ni çağıraraq qulağına bir şeylər pıçıldadı. Aişə - *radıyallahu anhə* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in bütün zövcələri yanında olduğu an qızı Fatimə - *radıyallahu anhə* – gəldi. Yerişi Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yerişindən heç bir şey ilə fərqlənmirdi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – qızını gördükdə buyurdu: «Xoş gəlmisən qızım. (Mərhəba). Sonra onu sağına yaxutda soluna oturtdu. Qulağına nə isə pıçıldadıqdan sonra qızı ağlamağa başladı. Onun ağladığını görüb qulağına yenə də gizlicə nə isə pıçıldadı. Bu dəfə o güldü. Mən, Fatimə - *radıyallahu anhə* – yə dedim: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu qədər zövcələrinin içərsində yalnız sənə sir dedikdən sonra sən hələ də ağlayırsan!». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – geddikdən sonra mən soruşdum. Peyğəmbər sənə nə buyurdu: «Mən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sirrini ifşa etmərəm». Peyğəmbər –

---

[877] Əbu Davud 3207, Nəsai 4/61,62, əl-Albani «Səhih Nəsai» 1846.
[878] Müslim 15/118.
[879] Darimi 1/37, İbn Məcə 1465, əl-Albani «Səhih ibn Məcə» 1197.

*sallallahu aleyhi və salləm* – dünyasını dəyişdikdən sonra mən Fatimə - *radıyallahu anhə* – dən soruşdum: «Üzərindəki haqqım üçün de görüm Peyğəmbər – *sallallahu aleyhi və salləm* – sənə nə buyurdu: «Bəli, indi deyə bilərəm. Birinci dəfə o mənim qulağıma pıçıldadıqda buyurdu: «Hər il Cəbrail – *əlehissəlam* – Quranı mənə bir və ya iki dəfə təkrarladırdı. Ancaq bu dəfə o bunu iki dəfə etdi. Bundan da əcəlimin yaxınlaşdığını başa düşdüm. Allahdan qorx və səbr et. Mən sənin üçün necə də gözəl ***Sələfəm*** (keçmişəm). Mən də ağladım. Mənim ağladığımı görüb ikinci dəfə mənim qulağıma pıçıldadı. Ya Fatimə! Mömin qadınların və ya bu ümmətimin qadınlarının seyyidi olmasından razı deyilsənmi (Başqa rəvayətdə: Yaxınlarımdan ilk öncə mənə qovuşan sən olacaqsan)» deyə buyurdu . Fatimə - *radıyallahu anhə* – atasının çəkdiyi izdirabları gördükdə: «Vay atam!» dedi. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – ona: «Atan bu gündən sonra bir daha izdirab çəkməyəcəkdir». Xeybərdə yediyi zəhərin acılarını hələ də hiss edirdi. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Xeybər fəth edildiyi zaman Peyğəmbər – *sallallahu aleyhi və salləm* – zəhər qatılmış bir qoyun qızardılması hədiyyə edildi (Zəhəri verən bir Yəhudi qadın idi). Peyğəmbər: «Burada olan Yəhudiləri toplayın» deyə buyurdu. Dərhal onları bir yerə topladılar. Peyğəmbər: «Sizdən bir şey soruşsam doğrumu cavab verəcəksiniz?» deyə buyurdu. Onlar: «Bəli» deyə cavab verdilər. Peyğəmbər: «Atanız kimdir?» deyə buyurdu. Onlar: «Filankəsdir» dedilər. Peyğəmbər: «Yalan söylədiniz. Atanız filankəsdir» deyə buyurdu. Onlar: «Doğru söylədin» dedilər. Peyğəməbər: «Mənə doğru söyləyəcəksinizmi?» deyə buyurdu. Onlar: «Bəli, əgər biz sənə yalan söyləsək sən bunu biləcəksən necə ki, atamız kimdir sualını bildiyin kimi» dedilər. Peyğəmbər: «Cəhənnəm əhli kimdir?» deyə buyurdu. Onlar: «Biz orada az qalacağıq. Orada bizə siz xələf olacaqsınız!» dedilər. Peyğəmbər: «Rədd olun! Vallahi biz əbədiyyən sizə Cəhənnəmdə xələf olmayacağıq» deyə buyurdu. Sonra: «Bu qoyuna zəhər qatmışdınız yoxsa yox?». Onlar: «Bəli, qatmışdıq» dedilər. Peyğəmbər: «Nəyə görə belə etdiniz?» deyə buyurdu. Onlar: «Yalançı (bir Peyğəmbər) olub-olmadığını yoxlamaq üçün. Əgər yalançı olsaydın bu zəhər sənə təsir edəcəkdi, yox əgər həqiqi bir Peyğəmbərsənsə bu zəhər əsla sənə zərər verməz» dedilər (Bəzi rəvayətlərdə: Qoyun budu dil açaraq Peyğəmbər – *sallallahu aleyhi və salləm* – ə zəhərli olduğunu bildirir. Bəzi rəvayətlərdə isə Cəbrail – *əleyhissəlam* – xəbər verir. Zəhər Peyğəmbər – *sallallahu aleyhi və salləm* – ə təsir etmədi. Lakin ətdən yeyən Bişr b. Bərra - *radıyallahu anhu* – yedi və öldü. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – ə bir zərər toxunmadığı üçün qadını buraxır. Lakin şəriətə uyğun olaraq qadını Bişr b. Bərra - *radıyallahu anhu* – nun ailəsinə təslim edir. Onlar da qisas olaraq onu qətl edirlər) .

Ölüm anı yaxınlaşınca Aişə - *radıyallahu anhə* – onu köksünə basırdı. Hicri **11**-ci ilin Rəbiul əvvəl ayının **12**-si ya da **13**-cü günündə ölüm halları onda görünməyə başladıqda, əlini suya salır, üzünə sürtür və buyururdu: «***Lə İləhə İlləllah***. Şübhəsiz ki, ölümün istirabları çox ağırdır». Daha sonra gözləri səmaya doğru dikildi və: «Allahım o, ***Rafiqul Ələ*** ən uca dostlar arasında olmaq istəyirəm» dedi. O, gün vəfat etdi. Aişə - *radıyallahu anhə* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – dizləri və

---

[880] Aişə - *radıyallahu anhə* –, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – in zövcəsi həm də möminlərin anası olduğu üçün belə deyir.
[881] Buxari 2623; Müslüm 2450;
[882] Buxari «Cizyə» 7.

köksüm üzərində vəfat etdi. Onun ölüm acısını gördükdən sonra artıq kimsənin ölüm acısı məni üzməz» .

Vəfat xəbəri bir neçə dəqiqədə səhabələr arasında yayıldı. Bu acı xəbər onların dünyalarını qaraltdı. Üzüntüdən şüurlarını itirəcək hala gəlmişdilər. Nə edəcəklərini bilmədən hıçqıra-hıçqıra ağlayırdılar. Ömər - *radıyallahu anhu* – məscidə gələrək: «Allah münafiqləri yox edincəyə qədər Rəsulullah ölməyəcəkdir» deyə qışqırmağa və öldü deyəni öldürəcəyini söyləməyə başladı. İnsanlar nə edəcəklərini bilmədən şaşqınlıq içində sağa-sola hərəkət edirdilər. Aişə - *radıyallahu anhə* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – vəfat etdikdə Əbu Bəkr - *radıyallahu anhu* – Sunhda idi. Əbu Bəkr - *radıyallahu anhu* – bu xəbəri eşidincə evindən yola çıxır və məscidin qapısına kimi gəlir. Orada Ömər - *radıyallahu anhu* – xalqa bir şeylər söylədiyini görür. Lakin əhəmiyyət vermədən Aişə - *radıyallahu anhə* – nin evinə üzəri örtülü vəziyyətdə olan Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına girir. Üzərindəki örtüyü qaldıraraq onu öpür və: «Atam, anam sənə fəda olsun! Sağlığında da səndən gözəl iy gəlirdi, öləndən sonra da səndən gözəl iy gəlir. Nəfsim əlində olan Allaha and olsun ki, Allah ölümü sənə iki dəfə daddırmaz. Əbu Bəkr - *radıyallahu anhu* – camaatın yanına çıxır. Allaha həmd səna etdikdən sonra: «Ey insanlar! Kim Muhəmmədə ibadət edirdisə bilsin ki, artıq o, vəfat etmişdir. Kim Allaha ibadət edirdisə bilsin ki, Allah əbədi və ölməzdir: ***«Şübhəsiz ki, sən də öləcəksən, onlar da öləcəklər!».*** *(əz-Zumər 30).* ***«Muhəmməd ancaq bir Peyğəmbərdir. Ondan əvvəl də peyğəmbərlər gəlib getmişlər. Əgər o, ölsə və ya öldürülsə siz gerimi dönəcəksiniz? Halbuki geri dönən şəxs Allaha heç bir zərər yetirməz. Lakin Allah şükr edənlərə mükafat verər».*** *(Ali İmran 144)* . Ömər - *radıyallahu anhu* – deyir ki: «Allaha and olsun ki, Əbu Bəkr - *radıyallahu anhu* – bu ayəni oxuyuncaya qədər Peyğəmbər– *sallallahu aleyhi və səlləm* – in vəfatına qane deyildim. Ayəni duyunca dəhşətə gəldim və yerə yıxıldım. Ayaqlarım yerində durmurdu. O, vaxt anladım ki, həqiqətən də Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dünyasını dəyişmişdir». Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – 1-ci günü dünyasını dəyişdi (Başqa rəvayətdə: **1**-ci günü dünyasını dəyişdi və **2-**ci günü isə dəfn edildi)» .

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in cəsədi **2**-ci günü yuyuldu. Aişə - *radıyallahu anhə* – deyir ki: «Onu yumaq istədikdə: «Ölülərimizi soyundurduğumuz kimi onu da soyundurub yuyaq, yoxsa paltarı əynində olduğu haldamı yuyaq» deyə təşviş içində qaldılar. Bu vaxt Allah onlara bir yuxu verdi. Hamımızın çənəsi köksünə düşdü. Evin bir kənarından tanımadıqları biri onlara xitab edərək dedi: «Onu üzərindəki paltarını çıxarmayaraq yuyun». Bundan sonra paltarı üzərindən suyu tökərək yumağa başladılar. Yumaq işinə Əli, Abbas, iki oğlu Fadl, Qasım, Usamə Şarkan su tökür, Əli - *radıyallahu anhu* – isə yuyurdu. Cəsədi üç dəfə yudular. Cəsədi yuduqları suyu Quba məscidində olan Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in də o, sudan içdiyi Sad b. Heysəmə quyusundan gətirmişdilər. Üç parça ağ Yəmən bezi ilə kəfənlədilər. Harada dəfn olunacağını müzakirə etdilər. Bəziləri Məkkədə, bəziləri Qütsdə dəfn olunmasını təklif etdilər. Əbu Bəkr - *radıyallahu anhu* – isə Peyğəmbərlər öldükləri yerdə dəfn olunurlar dedi və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in otağında qəbr qazıldı. Əbu Təlhə - *radıyallahu anhu* – qəbrini qazdı. Cənazə namazı

---

[883] Buxari 7/747.
[884] Buxari 3667.
[885] Tirmizi «Şəmaili Şərif».

qılındı. Otaq darısqal olduğu üçün ilk öncə qohum-əqrabası, sonra mühacirlər, ənsarlar, qadınlar və uşaqlardan başlamaq üzərə insanlar qrup halında gəlib cənazə namazı qılırdılar. Beləcə səhərə yaxın Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in mübarək cəsədi qəbrə endirildi və dəfn edildi. Fatimə - *radıyallahu anhə* – deyirdi: «Ey Ənəs! Allah Rəsulunu torpağa qoyub üzərinə torpaq atmağa könlünüz necə razı oldu» . Ənəs: «Onu torpağa qoyub üzərinə topraq atmaq bizim də qəlbimizi ağrıtmış, lakin biz bunu onun əmrini yerinə yetirmək məcburiyyəti ilə könüllərimiz ağlaya-ağlaya etdik».

## PEYĞƏMBƏRİMİZİN XÜSUSİYYƏTLƏRİ

Peyğəmbərimiz Muhəmməd – *sallallahu aleyhi və səlləm* – in bir neçə xüsusiyyətləri vardır:

***1. Peyğəmbərlərin Sonuncusudur - «Lakin o, Allahın Rəsulu və Peyğəmbərlərin sonuncusudur».*** *(əl-Əhzab 40).* Muhəmməd, Peyğəmbərlərin və Rəsulların sonuncusudur. O, Allahın risalətinin təbliği üçün seçdiyi son elçi, ona kitabların ən uca və ən əzəmətlisi endirilmişdi. O, Rəsulların əzəmətlisi, aləmlərin Rəbbinin həbibi və xəlilidir. Ondan sonra kim Peyğəmbərlik iddiasında olarsa kafirdir, onu doğrulayan da kafirdir. Bunda şübhə edən də kafirdir. Mömin ondan sonra Peyğəmbərin olmayacağına iman edər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Dəccal ilə əlaqəli olan hədisdə buyurur: «Mən Xatəmun-Nəbiyyinəm (Peyğəmbərlərin sonuncusuyam) və məndən sonra Peyğəmbər gəlməyəcəkdir» . Başqa rəvayətdə: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurur: «Məndən sonra Peyğəmbər yoxdur» . Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Məni əvvəlki Peyğəmbərlərlə müqayisə etdikdə, bu o şeyə bənzəyir ki, bir insan gözəl bir bina tikir, onu bəzəyir və evin bir kərpicini qoymur. Camaat evə baxdıqda deyirlər: «Necə ola bilər ki, o bu kərpici qoymağı unudub?» Mən isə həmin o, sonuncu kərpicəm» . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mənim isimlərim var. Mən Muhəmmədəm, mən Əhmədəm, mən Məhi (məhv edici) Allah mənimlə küfrü məhv edər. Mən Həşirəm – insanlar mənim ayaqlarımın izi ilə həşr olunurlar. Mən Akibəm. Akib isə məndən sonra Peyğəmbər göndərilməyəndir» .

***2. Allah Onu Ən Yüksək Məqama Yüksəldib -*** Ən yüksək məqam isə şəfaət məqamıdır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – orada şəfaət edəcək. ***«Gecənin bir vaxdı durub yalnız sənə xas olan əlavə namaz qıl. Ola bilsin ki, Rəbbin səni bəyənilib təriflənən bir məqama göndərsin».*** *(əl-İsra 79).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü insanların seyyidi mənəm, qəbri açılacaq ilk kişi mənəm. İlk şəfaət edən və şəfaəti qəbul olunacaq ilk kişi də mən olacağam» .

***3. Hər Bir Peyğəmbər Öz Qövmünə, O İsə Hamıya Göndərilmiş Peyğəmbərdir - «Ey insanlar! Mən Allahın sizin hamınıza göndərilmiş Peyğəmbəriyəm».*** *(əl-Əraf 158). (Ey Muhəmməd!)* ***Biz səni bütün insanlara müjdə verən, qorxudan bir Peyğəmbər göndərdik. Lakin insanların əksəriyyəti bilməz».*** *(Səba 28).* ***«Biz səni insanlara Peyğəmbər göndərdik. Allahın buna şahid olaması*** *(sənə)* ***kifayət edər».***

[886] Buxari 7/753, İbn Məcə 1630, Darimi 1/40.
[887] İmam Əhməd «Musnəd» 3/79.
[888] Əbu Davud 4/98,121, Tirmizi 4/498,499, Musnəd 5/16,41,46.
[889] Buxari, Müslim.
[890] Buxari, Müslim.
[891] Müslim, Əbu Davud 4673, Musnəd 2/540.

*(ən-Nisa 79).* Cabir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mənə beş şey verilib ki, bundan qabaq heç bir Peyğəmbərə verilməyib… Hər bir Peyğəmbər müəyyən bir qövmə göndərilib mən isə hamıya göndərilmiş Peyğəmbərəm» .

***4. Peyğəmbərimiz Xəlildir*** - Məhəbbətin ən yüksək dərəcəsi olan Xəlillik dərəcəsinə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – də çatmışdır. Şübhəsiz Allah İbrahimi xəlil etdiyi kimi məni də xəlil etmişdi . Bu hədis Xəlil İbrahimə, məhəbbət isə Muhəmmədə aid bir məqamdır deyənlərin fikirlərini məhv edir. Çünki Məhəbbət digər insanlar haqqında da sabitdir. ***«Allah tövbə edənləri, təmiz və pak olanları sevər».*** *(əl-Bəqərə 222).* ***«Şübhəsiz ki, Allah müttəqiləri sevər».*** *(Ali-İmran 76).* ***«Allah yaxşılıq edənləri sevər».*** *(Ali-İmran 134).* Beləliklə xəlillik İbrahimə, həbiblik Muhəmmədə xas olduğunu söyləyənlərin sözlərinin tutarsız olduğu ortaya çıxdı. Əksinə xəlillik hər iksinə də aiddir, həbiblik isə ümumidir. Ola bilər ki, kimsə sizə belə bir hədis də gətirə bilər. Lakin bilin ki, bu hədis zəifdir. İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İbrahim Allahın Xəlilidir. Bunu da bilin ki, mən Allahın həbibiyəm və övünmürəm» .

***5. Qurani Kərim - «De ki: «Şahidlik baxımından nə daha böyükdür? Mənimlə sizin aranızda Allah şahiddir. Bu Quran mənə sizi və ona*** *(gələcəkdə)* ***yetişəcək kims****ələri (Qiyamətə qədər)* ***xəbərdarlıq edib qorxutmağım üçün vəhy olunub».*** *(əl-Ənam 19).* ***«Aləmləri qorxutmaq üçün haqqı batildən ayıran Quranı öz bəndəsinə*** *(Muhəmmədə)* ***nazil edən Allah nə qədər uca, nə qədər uludur».*** *(əl-Furqan 1).* Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Peyğəmbərlərdən elə bir peyğəmbər yoxdur ki, ona bəşərin məğlub olaraq inandığı (bir möcüzə) verilmiş olmasın. Möcüzə olaraq mənə verilən şey isə Allahın mənə vəhy etdiyi Qurandır» .

***6. Allah Onun Həyatına And İçmişdir*** - Allah şərəfini ucaltmaq və hörmətini artırmaq üçün həyatına and içdiyi tək insan Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dir. *«(Ya Rəsulum!)* ***Canına and olsun ki, onlar məstlikləri*** *(küfrləri)* ***içində sərgərdan*** *(şaşqın)* ***vəziyyətdə durub qaldılar.*** *(Lutun nəsihətini qəbul etmədilər)».* *(əl-Hicr 72).* İbn Abbas - *radıyallahu anhu* – deyir ki: «Allah Muhəmməd – *sallallahu aleyhi və səlləm* – dən daha dəyərli heç kimsəni yaratmamışdır. Allahın ondan başqa bir kimsənin həyatına and içdiyini bilmirəm».

***7. Peyğəmbərin İsminin Zikr Edilməsi*** - Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in İsmi Qurani Kərimdə **4** yerdə zikr edilmişdir: ***«Muhəmməd ancaq bir Peyğəmbərdir. Ondan əvvəl də Peyğəmbərlər gəlib-getmirlər. Əgər o, ölsə və ya öldürülsə, siz gerimi dönəcəksiniz?*** *(Dininizdən dönəcək və ya döyüşdən qaçacaqsınız?)* ***Halbuki geri dönən şəxs Allaha heç bir zərər yetirməz. Lakin Allah şükür edənlərə mükafat verər».*** *(Ali İmran 144).* ***«Muhəmməd aranızdakı kişilərdən heç birinin atası deyildir.*** *(Oğul odur ki, kişinin öz belindən əmələ gələ!)* ***Lakin o, Allahın Rəsulu*** *(elçisi)* ***və Peyğəmbərlərin sonuncusudur. Allah hər şeyi biləndir!»*** *(əl-Əhzab 40).* ***«İman gətirib yaxşı əməllər edənlərin, Rəbbindən Muhəmmədə haqq olaraq nazil edilənə*** *(Qurana)* ***inanların isə günahlarının üstünü örtəcək, onların***

---

[892] Buxari, Müslim.
[893] Müslim.
[894] Tirmizi 3620 qərib hədis. Sənədi zəif.
[895] Müslim.

***əhvalını** (dünyada və axirətdə) **düzəldəcəkdir** (yaxşılaşdıracaqdır)».* (Muhəmməd 2). ***«Muhəmməd** (əleyhissəlam) **Allahın Peyğəmbəridir. Onunla birlikdə olanlar** (möminlər) **kafirlərə qarşı sərt, bir-birinə** (öz aralarında) **isə mərhəmətlidirlər. Sən onları** (namaz vaxtı) **rüku edən, səcdəyə qapanan, Allahdan riza və lütf diləyən görərsən. Onların əlaməti üzlərində olan səcdə izidir.** (Qiyamət günü onlar üzlərindəki möminlik nuru alınlarındakı möhür yeri ilə tanınırlar). **Bu onların Tövratdakı vəsfidir. İncildə isə onlar elə bir əkinə bənzədilirlər ki, o artıq cücərtisini üzə çıxarmış, onu bəsləyib cana-qüvvətə gətirmiş, o da** (o cücərti də) **möhkəmlənib gövdəsi üstünə qalxaraq əkinçiləri heyran qoymuşdur.** (Allahın bu təşbihi) **kafirləri qəzəbləndirmək üçündür. Onlardan iman gətirib yaxşı əməllər edənlərə Allah məğfirət** (günahlardan bağışlanma) **və böyük mükafat** (Cənnət) **vəd buyurmuşdur!».** (əl-Fəth 29).*

***8. Peyğəmbərimizin Meracı -*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – on il Allahın əmrinə tabe olaraq tövhidə dəvət etdi. On ildən sonra göylərə yüksəldi. Merac – ***Aracə*** sözündən götürülüb. ***Uruc*** - qalxmaq, yüksəlmək deməkdir. İsra – ***Əsra*** sözündən götrülüb. Bəziləri-nin dediyinə görə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Merac səfərini yuxuda edib, digərlərinin dediyinə görə o – *sallallahu aleyhi və səlləm* –, Meraca yalnız ruhu ilə gedib. Lakin səhih odur ki, həm ruhu, həm də cəsədi ilə gedib və ömründə bir dəfə olub. Bu hadisə Məkkədə Peyğəmbərlikdən sonra və hicrətdən bir il əvvəl **27** Rəcəb **621**- ci ildə baş verib. Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Kəbədə əl-Hicr deyə adlanan yerdə yatarkən biri gəlib boğazından qarnının alt tərəfinə qədər olan hissəni yardı. Qəlbini çıxardıb zəm-zəm suyu ilə yuduqdan sonra onu hikmət və iman ilə doldurdu. Bu da onu irəlidə gözlənilən üçün hazırlıq idi. Sonra qatırdan alçaq, eşşəkdən böyük olan Burak adı verilən ağ bir minik gətirildi. Bu minik addımını gözün son görmə həddinə qoyardı. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə birlikdə Cəbrail – *əleyhissəlam* – olduğu halda miniyə mindilər. Beytul Məqdisə gəldik. Onu (məndən əvvəlki) Peyğəmbərlərin bağladıqları halqaya bağladım. Sonra məscidə girdik. Peyğəmbərlərə imam olaraq iki rükət namaz qıldıq. Bütün Peyğəmbərlər də onun arxasında namaz qıldılar. Beləliklə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in fəziləti, şərəfi və ona uyulan bir imam olduğu ortaya çıxmış oldu. Oradan çıxdıqdan sonra Cəbrail – *əleyhissəlam* – mənə bir qab şərab və bir qab da süd gətirdi. Mən südü seçdim. Cəbrail – *əleyhissəlam* – mənə: «Sən fitrəti seçdin, ümmətində fitrət üzərindədir» dedi. Sonra Cəbrail – *əleyhissəlam* – ilə birlikdə dünya səmasına yüksəldik. Birinci səmanın qapılarının açılmasını istədi. «O, kimdir?» deyə soruşdular. «Cəbrail» dedi. «Yanında kim var?» deyə soruşdular. «Muhəmməd» deyə cavab verdi. «Ona risalət verildimi?» deyə soruşdular. «Bəli» dedi. Bu dəfə: «Səfa gəldi, xoş gəldi» deyildi və ona səmanın qapısı açıldı. Birinci səmada Adəm – *əleyhissəlam* – göründü. Cəbrail ona: «Bu sənin baban Adəmdir, ona salam ver» dedi. Peyğəmbər ona salam verdi, o da salamı alıb və «Saleh övladıma saleh Peyğəmbərə salam olsun» dedi. Adəmin sağ tərəfində xoşbəxt kimsələrin ruhları, sol tərəfdə isə bədbəxt kimsələrin ruhları vardır. O, sağ tərəfinə baxanda sevinər və gülərdi, sol tərəfinə baxdıqda isə ağlayardı. Çünki sağ tərəfdə olanlar Cənnət əhli, sol tərəfində olanlar isə Cəhənnəm əhlindən olan kimsələr idi. Sonra Cəbrail onunla ikinci səmaya çıxdı və səmanın qapısının açılmasını istədi. «O, kimdir?» deyə soruşdular. «Cəbrail» dedi. «Yanında kim var?» deyə soruşdular. «Muhəmməd» deyə cavab verdi. «Ona risalət verildimi?» deyə soruşdular. «Bəli» dedi.

Bu dəfə: «Səfa gəldi, xoş gəldi» deyildi və ona səmanın qapısı açıldı. İkinci səmada Yəhya və İsa (hər iksinə Allahın salat və salamı olsun) göründü. Cəbrail dedi ki, bunlar Yəhya və İsadır – *əleyhimussəlam* –, hər iksinə salam ver. O, da onlara salam verdi, onlar da salamını alıb: «Saleh qardaşımıza və saleh Peyğəmbərə salam olsun» dedilər. Sonra Cəbrail onunla üçüncü səmaya çıxdı və səmanın qapısının açılmasını istədi. «O, kimdir?» deyə soruşdular. «Cəbrail» dedi. «Yanında kim var?» deyə soruşdular. «Muhəmməd» deyə cavab verdi. «Ona risalət verildimi?» deyə soruşdular. «Bəli» dedi. Bu dəfə: «Səfa gəldi, xoş gəldi» deyildi və ona səmanın qapısı açıldı. Üçüncü səmada Yusif – *əleyhissəlam* – göründü. Cəbrail dedi ki, bu Yusifdir, ona da salam ver. O, da salam verdi, salamını alıb: «Saleh qardaşımıza və saleh Peyğəmbərə salam olsun» dedi. Sonra Cəbrail onunla dördüncü səmaya çıxdı və səmanın qapısının açılmasını istədi. «O, kimdir?» deyə soruşdular. «Cəbrail» dedi. «Yanında kim var?» deyə soruşdular. «Muhəmməd» deyə cavab verdi. «Ona risalət verildimi?» deyə soruşdular. «Bəli» dedi. Bu dəfə: «Səfa gəldi, xoş gəldi» deyildi və ona səmanın qapısı açıldı. Dördüncü səmada İdris – *əleyhissəlam* – göründü. Cəbrail dedi ki, bu İdrisdir, ona da salam ver. O, da salam verdi, salamını alıb: «Saleh qardaşımıza və saleh Peyğəmbərə salam olsun» deyə dua etdi. Allah buyurur: ***«Biz onu yüksək məqama qaldırdıq».*** *(Məryəm 57).* Sonra Cəbrail – *əleyhissəlam* – onunla beşinci səmaya çıxdı və səmanın qapısının açılmasını istədi. «O, kimdir?» deyə soruşdular. «Cəbrail» dedi. «Yanında kim var?» deyə soruşdular. «Muhəmməd» deyə cavab verdi. «Ona risalət verildimi?» deyə soruşdular. «Bəli» dedi. Bu dəfə: «Səfa gəldi, xoş gəldi» deyildi və ona səmanın qapısı açıldı. Beşinci səmada Musa – *əleyhissəlam* – ın qardaşı İmran oğlu Harun – *əleyhissəlam* – göründü. Cəbrail dedi ki, bu Harundur, ona da salam ver. O, da salam verdi, salamını alıb: «Saleh qardaşımıza və saleh Peyğəmbərə salam olsun» dedi. Sonra Cəbrail onunla altıncı səmaya çıxdı və səmanın qapısının açılmasını istədi. «O, kimdir?» deyə soruşdular. «Cəbrail» dedi. «Yanında kim var?» deyə soruşdular. «Muhəmməd» deyə cavab verdi. «Ona risalət verildimi?» deyə soruşdular. «Bəli» dedi. Bu dəfə: «Səfa gəldi, xoş gəldi» deyildi və ona səmanın qapısı açıldı. Altıncı səmada Musa – *əleyhissəlam* – göründü. Cəbrail dedi ki, bu Musadır, ona da salam ver. O, da salam verdi, salamını alıb: «Saleh qardaşımıza və saleh Peyğəmbərə salam olsun» dedi. Yanından getdikdə Musa ağladı. «Nəyə ağlıyırsan?» deyildikdə: «Çünki məndən sonra Peyğəmbər olaraq göndərilən bu gəncin ümmətindən Cənnətə girəcək olanlar, mənim ümmətimdən Cənnətə girəcək olanlardan daha çoxdur (Başqa rəvayətdə: Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İsra gecəsində Musanın yanına çatdım. Qırmızı qum təpəsinin yanındakı qəbrində namaz qılırdı» ). Sonra Cəbrail onunla yeddinci səmaya çıxdı və səmanın qapısının açılmasını istədi. «O, kimdir?» deyə soruşdular. «Cəbrail» dedi. «Yanında kim var?» deyə soruşdular. «Muhəmməd» deyə cavab verdi. «Ona risalət verildimi?» deyə soruşdular. «Bəli» dedi. Bu dəfə: «Səfa gəldi, xoş gəldi» deyildi və ona səmanın qapısı açıldı. Yeddinci səmada Xalilur-Rahmən İbrahim – *əleyhissəlam* – göründü. Cəbrail dedi ki, bu sənin atan İbrahimdir, ona da salam ver. O, da salam verdi, salamını alıb: «Saleh övlad və saleh Peyğəmbərə salam olsun» dedi.

Cəbrail – *əleyhissəlam* – Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – i bu Peyğəmbərlərin yanına götürməsi, ona olan bir ikram, onun şərəfini və fəzilətini ortaya

---

[896] Müslim «Fəzail» 2375.

çıxarmaq üçün idi. İbrahim – *əleyhissəlam* – belini yeddinci səmadakı Beytul-Məmura söykəmişdi. Bu Beytul-Məmura gündə yetmiş min mələk girər, orada Allaha ibadət edər, namaz qılar, sonra oradan çıxar və bir daha oraya qayıtmazlar. Sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Sidrətul Muntəhaya qədər yüksəldi. Allahın əmri ilə orada olan gözəllikləri gördü. Sonra Allah Muhəmməd – *sallallahu aleyhi və səlləm* – ə bir gün və bir gecədə əlli vaxt namaz fərz qıldı. Peyğəmbər buna təslimiyyətlə razı oldu. Səmadan enib Musa – *əleyhissəlam* – ın yanından keçəndə ona: «Rəbbin ümmətinə nəyi fərz qıldı?» dedi. «O, bir gündə əlli namaz fərz qıldı». Musa: «Sənin ümmətinin buna gücü çatmaz. Səndən əvvəl mən öz ümmətimə bunu bəyan etmişdim. İsrail oğullarından çox çətinliklərlə qarşılaşdım. Rəbbinə qayıt və ümmətin üçün yükünün yüngülləşdirilməsini dilə». Bundan sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bir neçə dəfə Rəbbinə müraciət etdi və namaz beş vaxt sayına qədər azaldıldı. Bundan sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə Cənnət və Cəhənnəm də göstərildi. Usamə b. Zeyd - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «(Merac gecəsində) Cənnətin qapısında durub içəri baxdım. Oraya girənlərin böyük çoxluğunun miskinlər olduğunu gördüm. Mal sahiblərindən Cəhənnəmlik olanlardan başqaları (haqq-hesab) üçün həps olunmuşlar. Atəş əhli olan zənginlərin isə Cəhənnəmə atılmaları öncə əmr olunmuşdur. Cəhənnəmin qapısında da durdum. Bir də baxdım ki, Cəhənnəmə girənlərin çoxu qadınlardır (Başqa rəvayətdə: «Biz nəyə görə Cəhənnəm əhlinin çox hissəsi olacağıq)» dedilər. Peyğəmbər: «Çünki çox lənət edir, ərlərnizə qarşı nankorluq edirsiniz. Yaxşılığa qarşı küfr edirsiniz. Onlardan birinə dünya durduqca yaxşılıq etsən və sonra səndən məmnun olmayacaq bir şey görsə – səndən heç bir xeyir görmədim deyər. Ağıl və din naqisliyi də vardır. Sizin qədər ağlı başından alaraq kişiyə üstün gələni görmədim». Qadınlar: «Ağıl və din naqisliyi nədir?» deyə soruşdular. Peyğəmbər: «Ağlı nöqsanlığa gəldikdə – iki qadının şahidliyi bir kişinin şahidliyinə bərabərdir. Dini naqisliyə gəldikdə isə – (heyzli günlərdə) namaz qılmazsınız və Ramazanda da (bir müddət) oruc tutmazsınız»[897]. Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İsra gecəsində dırnaqları uzun olan bir qövmə çatdım. Onlar üzlərini və (kökslərini) cırmaqlayırdılar». Mən: «Ey Cəbrail! Bunlar kimlərdir?» deyə soruşdum. Cəbrail: «Bunlar insanların ətlərini yeyənlərdir (qeybət edənlər)» deyə buyurdu[898]. Daha sonra Peyğəməbr – *sallallahu aleyhi və səlləm* – səmadan enib Məkkəyə geri döndü»[899]. Cabir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qureyş məni təqzib etdiyi vaxt Allah Beytul Məqdisi mənə təcəlli etdi. Mən onlara onun əlamətlərini bir-bir xəbər verməyə başladım. Mən Beytul Məqdisə baxır, həm də xəbər verirdim»[900].

***9. Peyğəmbərimizin Möcüzələri*** **-** Allah Peyğəmbərinə nübuvətinin bir dəlili olmaq üçün vermiş olduğu olduqca böyük möcüzələrdən biri də ***İnşiqaqi-Qamər*** (ayın bölünməsi) möcüzəsidir[901]. İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Ay

---

[897] Buxari «Rikak» 51, Müslim 79, 2736.
[898] Əbu Davud 4870, 4879.
[899] Buxari, Müslim.
[900] Buxari, Müslim 170.
[901] ***Möcüzə*** – insanların gördükləri və ya Peyğəmbər olaraq göndərənin varlığına kəsin bir dəlildir. Onları göndərən isə Allahdır. Çünki bunlar bəşəriyyətin güc və taqətindən kənar olan xüsuslardır. Allah möcüzələri Peyğəmbərlərini dəstəkləmək və onlara kömək etmək üçün meydana gətirir. ***Kəramət*** – Allahın saleh (yalnız saleh) qullarına Allahdan

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – zamanında iki parçaya bölündü. Peyğəmbər: «Şahid olun!» deyə buyurdu. (Başqa rəvayətdə: «Biz Minada Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə bərabər ikən ay iki parcaya ayrıldı. Bir parçası dağın arxasına, bir parçası isə dağın önündə idi». Bizə: «Şahid olun» deyə buyurdu . Cabir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – minbər olmayanda kötüyün üstündə xütbə verərdi. Minbər düzəldikdə isə kötüyü tərk edir. Səhabələr o, kötüyün yanından keçərkən onun inildəməsini, ağlamasını eşidib Peyğəmbərə xəbər verirlər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – gəlib o, kötüyü qucaqlayıb buyurur: «Bilirsiniz o, niyə ağlayır? Allahın ayələri onun üstündə zikr olunmadığına görə darıxır» . Cabir b. Səmura - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mən Məkkədə bir daş tanıyıram ki, mən Peyğəmbər göndərilmədən əvvəl mənə salam verirdi. Heç şübhəsiz ki, mən indi də o, daşı tanıyıram» . İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə birlikdə səfərdə idik. Suyumuz azaldı. Peyğəmbər: «Mənə bir az su tapın» deyə buyurdu. İçərisində bir az su olan qab gətirdilər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – əlini qabın içinə saldı. İndi təmiz və mubarək suya gəlin deyə buyurdu. İbn Məsud: «Allaha and olsun ki, su barmaqlarının arasından qaynadığını gördüm. Vallahi biz yeməyin təsbihini də eşidirdik» . (Başqa rəvayətdə: «İçiləsi su olmadığından Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə bir qab su gətrilir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – əlini qabın içinə saldı. Allaha and olsun ki, su barmaqlarının arasından qaynadığını gördüm. Hamımız o, sudan içdik». Cabirdən: «Siz o, gün neçə nəfər ididniz deyə soruşdular». Cabir: «Əgər biz yüz min də olsaydıq su bizə çatardı. Lakin biz o, günü **1500** nəfər idik») . Bəra - *radıyallahu anhu* – rəvayət edir ki, siz fəth dedikdə Məkkənin fəthini nəzərdə tutursunuz. Bəli, Məkkənin fəthi bir fəthdir. Lakin biz sahabələr fəth dedikdə Ridvan beyətini nəzərdə tuturuq. Biz o, vaxtı Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanında min dörd yüz nəfər idik. Hudeybiyyə isə bir quyunun adıdır. Biz o. quyunun

---

onlara bir ikram olaraq verdiyi bir şeydir. Bu kəramət Quran ayələri, hədislərdən və əsərlərdən məlum olduğu kimi Allah bir çox qullarına bunu ikram etmişdir. Məs: İsa – *əleyhissəlam* – dünyaya gəlməsi möcüzə, onun anası üçün isə kəramətdir. Zəkəriyyə – *əleyhissəlam* –ın Məryəm – *əleyhissəlam* – yanına girdikdə orada yayda qış meyvələrinin olduğunu, qışda isə yay meyvələrinin olduğunu görür. Musa – *əleyhissəlam* – ın anasına Allah vəd verir ki, biz uşağı sənə qaytaracağıq. Ömər - *radıyallahu anhu*– xütbə verərkən öz göndərdiyi qoşunun uduzduğunu görərək onlara qışqırır ki: «Ey Səriyyə! Dağa tərəf çəkil». Və həqiqətən də onlar qalib gəlib qayıtdıqda deyirlər ki, biz hamımız sənin səsini eşitdik. ***Sehr*** – İbn Qudamə – *rahmətullahi aleyhi* - deyir ki: «Sehr düyünlər, oxumalar və söylənən sözlər, yazılan ifadələr, edilən şeylərdir ki, bunlar sehr edilən kimsənin bədəninə, qəlbinə və ya ağlına bilavasitə təsir edir. Sehirin bir həqiqəti vardır ki, kimisə öldürür, kimisə xəstə edir, kimisə xanımına yaxınlaşmaqdan çəkindirir, ər və arvadı bir-birindən ayırır. Sehrin öyrənilməsi və öyrədilməsi haramdır. Bəziləri özlərinə təskinlik vermək üçün deyirlər ki, biz insanlara yaxşılıq edirik, onların dərdlərini azaldırıq. Buna da ağ maqiya adını verirlər. Lakin bu əsla belə deyildir. Nə ağ maqiya, nə də qara maqiya ilə məşğul olmaq olmaz. Bunların hər ikisi də haramdır. Bu işlə məşğul olan adam tövbə etməsə – Allah qorusun – dünyasını da, axirətini də puç edəcəkdir. Əgər sehr yaxşı bir şey olsaydı Allah ondan sığınmağı əmr etməzdi. Bax: ən-Nəs, əl-Fələq, əl-Bəqərə 102 və s. ***Kəramət Və Sehr:*** 1. Kəramət insanın istəyi ilə gəlmir. Onu Allah istədiyi vaxt və istədiyi saleh quluna verir. 2. Kəramət mömin bəndə üçün olur. 3. Kəramət sahibi təkəbbürlü olmaz və onu insanlar arasında yaymaz. 4. Kəraməti heç nə məhv edə bilməz. ***Möcüzə Və Sehr:*** 1. Bu dünyada möcüzə yoxdur. kəramət və ya sehr vardır. Peyğəmbərlər yoxdursa möcüzə də yoxdur. 2. Möcüzə qeyri adi bir şey olur. Allah elə bir möcüzə göstərir ki, insanlar dəhşətə gəlirlər. 3. Möcüzə iman gətirən şəxs üçün olur. Sehr isə kafir, fasiq və s. üçün olur. 4. Möcüzənin qarşısını heç nə ilə almaq olmaz. Sehri isə Quran ayələri, dualarla qarşısını almaq olar.

[902] Buxari “Mənakib” 27, Müslim 2800.

[903] Buxari.

[904] Müslim.

[905] Buxari «Mənakib» 25, «Vudu» 32, Müslim 2279, Tirmizi 3637.

[906] Buxari, Müslim 1856, 2279.

suyunu tam olaraq aldıq. Bir damla da belə buraxmadıq. Bu xəbər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – çatdı. Dərhal quyunun yanına gələrək kənarında oturub bir qab su istədi. Əlini yaxaladı, ağzına su alıb quyunun (içinə püskürtdü) və dua etdi. Sonra suyu quyuya tökdü. Sonra: «Quyunu bir müddət tərk edin» deyə buyurdu. Quyunu tərk edib bir az uzaqlaşdıq. (Bir müddətdən sonra) Quyu bizə və miniklərimizə yetəcək qədər su saldı . Ənəs b. Məlik – *radıyallahu anhu* – rəvayət edir ki, bir gün bir Bədəvi ərəb cümə günü Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – xütbə verərkən məscidə girib deyir: «Ey Allahın Rəsulu! Mallarımız tələf oldu, uşaqlarımız ac qaldı. Bizim üçün Allaha dua et». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – əllərini qaldıraraq dua etdi. Buludlar dağlar kimi ortaya yığıldılar. Minbərdən enməmiş yağış dənələri saqqalından süzülməyə başladı. İkinci cümə yenə o, bədəvi ərəb qalxıb dedi: «Ey Allahın Rəsulu! Evlərimiz dağıldı, mallarımızı sular yuyub apardı. Bizim üçün Allaha dua et» Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – əllərini qaldıraraq dua etdi: «Allahım üztümüzə, ətrafımıza yox!» Əli ilə işarə etdiyi tərəfə yağış yağmağa başladı» . Bədr döyüşündə Qatadə - *radıyallahu anhu* – nun gözü çıxmış və yanağına düşmüşdür. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəldi. Peyğəmbər: «Bismilləh» deyərək gözü yerinə qoydu. Göz olduğundan daha gözəl bir şəkildə yerində durdu. Digər gözündın daha sağlam görməyə başladı. Qatadənin övladları atalarının başına gələn bu mçcüzə ilə daima iftixar edərdilər. Qatadənin oğlu xəlifələrdən birinin yanına girərkən Xəlifə kimliyini soruşdu. Qatadənin oğludur – dedilər. Qatadənin oğlu: «Mən gözü ynağşna düşmüş Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yerinə qoyduğu kişinin oğluyam». əl-Həkəm b. Əbil Asim adlı bir nəfər Peyğəmbər ələ salaraq onun yolda yerişini təqlid edirdi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onun üçün bəd dua etdi vı: «Sən el də qal!» dedi. Adam şikəst oldu və ölənə qədər titrəyərdi». Ağacın onunla danışması. Bir bədəvi Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına yaxınlaşdıqda Peyğəmbər: «Hara getmək istəyirsən?» deyə soruşdu. Bədəvi: «Ailəmin yanına» dedi. Peyğəmbər: «Sənə xeyirli bir xəbər deyimmi?». Bədəvi: «Nədir o?» dedi. Peyğəmbər: «Tək və ortağı olmayan Allahdan başqa ibadətə layiq haqq İlah olmadığına və Muhəmmədin Onun qulu və Rəsulu olduğuna şəhadət gətirərsən». Bədəvi: «Sənin bu dediyinə şəhadət edəcək bir dəlilin varmı?» dedi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – vadinin kənarında olan ağacı göstərərək: «Bu ağac» dedi. Ağac həmən yeri eşərək gəldi və Peyğəbər – *sallallahu aleyhi və səlləm* – in qarşısında durdu. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ondan üç dəfə şəhadət gətirməsini istədi. Ağac da onun dediyi kimi (üç dəfə) şəhadət gətirdi» .

Bundan başqa yeməyin çoxalması, Ovcunda daşların təsbih etməsi, daşların ona salam verməsi və s. kimi möcüzələri vardır. Alimlər xırdalı böyüklü Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in möcüzələrini üç minə qədər çatdırırlar .

## PEYĞƏMBƏRLƏRƏ İMANIN FAYDALARI

[907] Buxari «Ənbiya» 25, «Məğazi»35.

[908] Buxari.

[909] Sünən Darimi 16 səhih, İbn Hibban 6505, Şeyx Şueyb Arnavut səəih.

[910] Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – m möcüzələri haqqında geniş məlumata Buxari, Müslim, Əbu Davud, Tirmizi və s. kimi alimlərin hədis kitablarında baxa bilərsiniz.

**1.** Onların Allah tərəfindən haqq ilə, elçi olaraq göndərildiklərinə iman etmək. Onlardan hər hansı birisinin risalətini inkar edən kimsə, hamısını inkar etmiş sayılır. Məs: Allah buyurur: ***«Nuh qövmü Rəsulları yalanladılar».*** *(əş-Şuara 105).* Bu ayədən göründüyü kimi Allah onları bütün rəsulları yalanlamış olduqlarını qeyd edir. Halbuki onu yalanladıqlarında Nuhdan başqa rəsul yox idi. Buna görə də Muhəmməd – *sallallahu aleyhi və səlləm* – i yalanlayan və ona tabe olmayan Yəhudi və Xristianlar eyni zamanda Musa – *əlehissəlam* – ı, Məryəm oğlu İsa – *əlehissəlam* – ı da yalanlamaqda və ona tabe olmamaqdadırlar.

**2.** Peyğəmbərlərdən adlarını bildiklərimizə iman gətirir, adlarını bilmədiyimiz Peyğəmbərlərə də icma ilə iman gətiririk.

**3.** Onlardan bizə səhih olaraq nəql edilən xəbərləri təsdiq etmək.

**4.** Göndərilmiş olan Rəsulun şəriətinə gərəyincə əməl etmək. Bu rəsul da sonuncu olan Muhəmməd – *sallallahu aleyhi və səlləm* – dir.

**5.** Allahın qullarına olan rəhmət və mərhəmətini bilmək. Allah onları Öz yoluna yönəltmək, Allaha necə ibadət edəcəklərini onlara başa salmaq üçün Peyğəmbərlər göndərmişdir. Çünki insan tək ağlı ilə bunları dərk edə bilməz.

**6.** Allahın göndərdiyi peyğəmbərləri sevmək, onları təzim etmək və onlara yaraşır şəkildə tərif etmək. Çünki onlar Allahın rəsullarıdır, onlar Allaha ibadət etmiş, risalətini təbliğ etmiş və onun qullarına səmimi öyüd-nəsihət vermişdilər.

**7.** Bu böyük nemətə görə Allaha şükr etmək.

## AXİRƏTƏ İMAN

Əhli Sünnə Vəl Cəmaat axirət gününə etiqad edir və inanırlar. Bunun mənası da qiyamət gününə Allahın kitabında, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in sünnəsində ölümdən sonra Cənnətliklərin Cənnətə, Cəhənnəmliklərin də Cəhənnəmə girəcəyi zamana qədər meydana gələcək şeylərə dair verilmiş xəbərlərin hamısına inanmaqdır. Axirət günü Allahın insanları haqq-hesab və cəza (əməllərinin qarşılığını verməsi) üçün dirildəcəyi Qiyamət günüdür. Ona bu adın verilməsinin səbəbi, ondan sonra gün olmayacağına görədir. Çünki artıq Cənnətliklər Cənnətə, Cəhənnəmliklər də Cəhənnəmə yerləşdiriləcəklər. ***«Qiyamət mütləq gələcəkdir, ona heç bir şəkk-şübhə yoxdur. Lakin insanların çoxu inanmaz».*** *(əl-Mumin 59).* ***«Sizə vəd olunan*** *(qiyamət)* ***həqiqətdir. Haqq-hesab*** *(cəza və mükafat)* ***da labüddür».*** *(əz-Zariyat 5-6).*

Allah Qurani Kərimdə Allaha iman ilə, axirətə iman etməyi bir-birinə bağlı olaraq zikr etmişdir. ***«O, kəslər ki, sənə göndərilənə*** *(Qurana)* ***və səndən əvvəl göndərilənlərə*** *(Tövrat, İncil, Zəbur)* ***iman gətirir və axirətə də şəksiz inanırlar».*** *(əl-Bəqərə 4).* ***«Yaxşı əməl sahibi heç də üzünü günçıxana və günbatana tərəf çevirməkdən ibarət deyil. Yaxşı əməl sahibi əslində Allaha, Qiyamət gününə… inanandır».*** *(əl-Bəqərə 177).*

Əhli Sünnə Qiyamətin qopma vaxtını Allah tərəfindən bilindiyinə, Allahdan başqa kimsənin onu bilmədiyinə inanırlar. ***«Həqiqətən Qiyamətin qopacağı vaxtı ancaq Allah bilir».*** *(Loğman 34). (Ya Məhəmməd!)* ***Səndən qiyamət haqqında soruşurlar ki, nə vaxt qopacaq? De ki: «O, ancaq Rəbbimə məlumdur. Qiyamətin qopacağı vaxtı Allahdan başqa heç kəs bilə bilməz».*** *(əl-Əraf 187). (Ya Muhəmməd! Müşriklər)* ***Səndən qiyamətin nə vaxt qopacağı barəsində soruşurlar. Sən onun vaxtını nə bilirsən? Onu bütün təfərrüatı ilə bilmək ancaq sənin Rəbbinə məxsusdur».*** *(ən-Nəziat 42-44).* Ömər - *radıyallahu anhu* – nun rəvayət etdiyi hədisdə Peyğəmbər –

*sallallahu aleyhi və salləm* – dən Qiyamət saatı haqqında soruşan Cəbrail – *əleyhissəlam* – a Rəsulullah – *sallallahu aleyhi və salləm* – belə cavab vermişdi: «Soruşulan soruşandan cox bilmir» .

Lakin sünnə ilə həmən günün hansı olduğu barədə məlumat gəlmişdir. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Günlərin ən xeyirlisi cümə günüdür. O gün Adəm – *əleyhissəlam* – yaradıldı, o gün Cənnətə salındı, o gün Cənnətdən qovuldu və o gün qiyamət qopacaqdır (Başqa rəvayətdə: «Cümə günü bütün heyvanlar şəfəqdən gün doğuncaya qədər qiyamət qopar deyə qorxudan qulaqlarını şəkiliyərək dinləyərlər. Yalnız cinlər və insanlar bundan qafildirlər)» . Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Günlərin ən xeyirlisi cümə günüdür. O gün Adəm yaradıldı, o gündə vəfat etdi. O, gün sura üflənəcəkdir. O, gündə göydəkilər də, yerdəkilər də öləcəklər. O, gün mənə çox salavat gətirin. Sizin salavatınız harada olsanız mənə çatacaqdır». Biri: «Ey Allahın Rəsulu! Sən çürüdükdən sonra salavatımız sənə necə çatacaqdır?» deyə soruşdu. Peyğəmbər: «Doğrusu Allah Peyğəmbərlərin cəsədlərini yeməyi torpağa haram etmişdir» deyə buyurdu .

Axirət gününə imanın mənası onun şəkk-şübhəsiz olaraq gələcəyinə inanmaq və buna uyğun olaraq gərəyincə əməl etmək deməkdir. Qiyamətin qopmasından əvvəl ortaya çıxacaq qiyamətin böyük və kiçik əlamətlərinə iman, ölümə, ölümdən sonra qəbr sorğusuna, əzab və nemətinə, Sura üfürüləcəyinə, yaradılmışların qəbirlərindən çıxacaqlarına, qiyamətin hesab yerindəki dəhşətli və qorxulu hallarına, məhşərə, səhifələrin (əməl dəftərlərinin) açılacağına, tərəzinin və sırat körpüsünün ortaya qoyulmasına, hovuza, şəfaətə və digər xüsuslara, Cənnətə və ən yüksək mərtəbəsi Allahın üzünə baxmaq olan nemətinə, Cəhənnəmə və orada olan dəhşətli əzablara iman etmək axirətə iman etməyin içərsinə daxildir. Elm adamları Qiyamətin əlamətlərini kiçik və böyük əlamətlər olmaqla iki qismə ayırmışlar. ***«****(Məkkə müşrikləri)* ***özlərinə yalnız mələklərin, yoxsa Rəbbinin*** *(əzabının)****, yaxud da Rəbbinin bəzi qiyamət əlamətlərinin gəlməsinimi gözləyirlər? Rəbbinin bəzi qiyamətin əlamətləri gələcəyi gün əvvəlcə iman gətirməmiş və ya imanında bir xeyir qazanmamış şəxsə*** *(sonrakı)* ***imanı heç bir fayda verməz». De ki: «Gözləyin, doğrusu biz də gözləyirik».*** *(əl-Ənam 158).* ***«Ey insanlar! Rəbbinizdən qorxun. Həqiqətən qiyamət gününün zəlzələsi dəhşətli şeydir».*** *(əl-Həcc 1).* ***«Onlar*** *(kafirlər)* ***ancaq qiyamət saatının qəfildən başlarının üstünü almasınımı gözləyirlər? Onun əlamətləri artıq gəlmişdir. Qiyamət saatı onlara gəlib çatdığı zaman ibrət almaları*** *(peşman olub tövbə etmələri)* ***onlara nə fayda verər?».*** *(Muhəmməd 18).* ***«….Nə bilirsən, bəlkə də qiyamət saatı yaxındır! Ona inanmayanlar onun tez gəlməsini istərlər. İnananlar isə onun haqq olduğunu bilərək ondan qorxuya düşərlər. Bil ki, Qiyamət saatı haqqında mübahisə edənlər*** *(haqq yoldan)* ***azıb çox uzaq düşmüşlər».*** *(əş-Şura 17-18).*

## QİYAMƏTİN KİÇİK ƏLAMƏTLƏRİ

***Qiyamətin Əlamətləri İki Qismə Ayrılır*:**

**1.** ***Kiçik Əlamətlər*** **–** Bu əlamətlər çox uzun zaman davam edən və təkrarlanan

[911] Buxari, Müslim.
[912] Müslim, İmam Məlik «Muvatta» 1/108.
[913] Nəsai «Cümə» 3/5.

əlamətlərdir. Məs: Elmin yox olması, çəhalətin çoxalması, içki içilməsi, binaların ucaldılması və s.

**2.** ***Böyük Əlamətlər –*** Bu əlamətlər Qiyamətin qopmasına yaxın görüləcək ilk dəfə olacaq böyük hadisələrdir. Məs: Dəccalın çıxması, İsa - *əleyhissəlam* - ın gəlməsi, Yəcuc və Məcuc tayfaları və s[914].

Qiyamətin kiçik əlamətləri olduqca çoxdur. Bunlardan səhih yolla bizə çatan bəzilərini xatırladaq. Bu əlamətləri sıra ilə vermədim. Çünki əlamətlərin hansı sırayla olacağını bildirən bir dəlil yoxdur. Buna görə də alimlərin oldu və bitti dedikləri əlamətlərdən başladım. Diqqət çəkiləsi məsələlərdən biri də bəzi insanların Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in xəbər verdiyi Qiyamət əlamətlərinin çəkinəlisi və qadağan olunan bir əlamətlər kimi başa düşürlər. Lakin bu heç də belə deyildir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in xəbər verdiyi Qiyamətin əlamətlərinin hamısı çəkinəlisi və ya pis əlamət deyildir. Onların içərisində xeyirli olan əlamətlər də vardır.

**1.** ***Peyğəmbərimiz Muhəmməd – Sallallahu Aleyhi Və Səlləm – İn Göndərilməsi:*** Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mən Qiyamət günü ilə birlikdə göndərildim, bu iki barmaq kimi». Ravi Şöbə deyir ki: «O şəhadət barmağı ilə orta barmağını bir-birinə birləşdirdi. Onların bir-birinə olan üstünlüyü qədər»[915]. İmam Bağavi – *rahmətullahi aleyhi* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Allah tərəfindən göndərilməsi Qiyamətin yaxınlaşmasına səbəbdir. Əbu Cubeyr - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mən Qiyamət gününün küləyi ilə göndərilmişəm»[916].

**2.** ***Onunla Peyğəmbərliyin, Risalətin Sona Yetməsi Və Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – İn Vəfat Etməsi:*** Auf b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günündən qabaq altı hadisəni gözləyin: «Mənim ölümümü»[917]. Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Mədinəyə gələndə bütün şəhər sevinirdi. O, öldüyü gün isə bütün şəhər zülmətə qərq olmuşdu[918]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dünyasını dəyişdikdən sonra Əbu Bəkr və Ömər - *radıyallahu anhum* – onun süd anasını ziyarət etmək qərarına gəlirlər. Qoca qadın ilə görüşdükdə onun ağladığını görüb deyirlər: «Nə üçün ağlayırsan? Allah Rəsulu üçün Onun (Allahın) dərgahında daha yaxşıdır» Qoca qadın dedi: «Mən ona görə ağlayıram ki, artıq vəhylər gəlməyəcəkdir». Bu sözlər Əbu Bəkr və Ömər - *radıyallahu anhum* – da ağlamağa məcbur etdi[919].

**3.** ***Beytul-Məqdisin Fəth Edilməsi:*** Auf b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günündən qabaq altı hadisəni gözləyin: «Qüdsün (Yerusəlimin) fəth edilməsi»[920]. Ömər - *radıyallahu anhu* – nun xəlifəliyi dövründə, hicrətin **16-**cı ilində Qüds zəbt olunur və orada bir məscid də inşa edilir[921].

---

[914] "Fəthul Bəri" 13/485, ət-Təzkira s. 624.
[915] "Fəthul Bəri", Buxari "Rikak" 11/347, Müslim "Fitən".
[916] əd-Daulabi, əl-Albani səhih.
[917] Buxari "Cizyə", "Fəthul Bəri" 6/277.
[918] Tirmizi "Mənakib", "Tuhfətul Əhfazi" 10/87-88, Şueyb əl-Arnaut səhih olduğunu qeyd edir.
[919] Müslim "Fadailus Sahabə", İmam Nəvəvi "Şərh Müslim" 16/9-10.
[920] Buxari "Cizyə", "Fəthul Bəri" 6/277.
[921] "əl–Bidâyə vən–Nihâyə" 7/55–57

**4.** ***Taun Xəstəliyi:*** Auf b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günündən qabaq altı hadisəni gözləyin: «Çox ölənlər olur. Sizin içinizdə heyvanların burunlarından axan və bir anda öldürən xəstəlik olacaqdır”[922]. İbn Həcər – *rahmətullahi aleyhi* – deyir ki: “Bu əlamət Ömər - *radıyallahu anhu* – nun zamanında Qütsün fəthindən sonra Amvasta baş vermişdir”[923]. Taun hicrətin **18**-ci ilində Amvasta baş vermiş və sonra Şam tərəfə də yayılmışdır. Ölənlərin sayı **25000** min nəfər olmuşdur. Bu ümmətin əmini olan Əbu Ubeydə b. Cərrah - *radıyallahu anhu* – da bu xəstəlikdən ölmüşdür[924].

**5.** ***Malın Çoxalması, Sədəqə Və Zəkatın Veriləcək Kimsənin Olmaması:*** Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Aranızda mal çoxalmadıqca Qiyamət qopmaz. Elə ki, mal sel kimi axacaq, mal sahibi sədəqə verəcək kimsə tapmayacaqdır. Zəkat veriləcək kimsə: “Mənim zəkata ehtiyacım yoxdur” deyəcəkdir[925]. Əbu Musa - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “İnsanlara elə bir zaman gələcək ki, əldə qızıl zəkat vermək üçün adam axtarılacaq, lakin zəkat veriləcək kimsə tapılmayacaqdır”[926]. Adiy b. Hatim - *radıyallahu anhu* – rəvayət edir ki, Mən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanında ikən bir nəfər gəlib yoxsulluqdan şikayət etdi. Sonra digər bir nəfər gəldi və yol kəsən quldurlardan şikayət etdi. Peyğəmbər: “Ey Adiy! Hirə şəhərini gördünmü?” deyə buyurdu. Adiy: “Xeyr, yalnız eşitdim” dedim. Peyğəmbər: “Əgər ömrün uzun olsa dəvə üzərində bir qadının Allahdan başqa kimsədən qorxmadan Kəbəyə gəlib təvaf edəcəyini görəcəksən” deyə buyurdu. Öz-özümə: “Bizim Tai qəbiləsinin yol kəsənləri varaaa! (Onların əlindən hara gələ bilər)” dedim. Peyğəmbər: “Əgər ömrün uzun olsa Kisranın xəzinələrinin fəth ediləcəyini görəcəksən” deyə buyurdu. Mən: “Kisra b. Hurmuzmu?” dedim. Peyğəmbər: “Bəli, Kisra b. Hurmuz və əgər ömrün uzun sürərsə qızıl və gümüş dolu kisəsini çıxarıb zəkat vermək istəyən adamı görürsən. Lakin zəkat alacaq kimsə olmayacaqdır (tapmayacaqdır). Hər biriniz mütləq bir gün gələcək aranızda heç bir pərdə, tərcüməçi olmadan Allahla qarşılaşacaqsınız. O, zaman Allah: “Səni təbliğ edən bir Peyğəmbər göndərmədimmi?” deyə buyuracaq. O: “Bəli, göndərdin” deyəcəkdir. Allah: “Mən sənə mal vermədimmi? Ikram etmədimmi?” deyə soruşacaq. Qul: “Bəli, Ey Rəbbim, verdin” deyib sağına baxacaq Cəhənnəmdən başqa bir şey görməyəcəkdir, soluna baxacaq Cəhənnəmdən başqa bir görməyəcəkdir”. Adiy - *radıyallahu anhu* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in belə buyurduğunu eşitdim: “Bir xurmanın yarısı da olsa onu sədəqə verib özünüzü Cəhənnəmdən qoruyun. Kim yarım xurma tapmazsa gözəl bir sözlə qorunsun”. Adiy: “Allahdan başqa kimsədən qorxmadan Kəbəni təvaf etməyə gedən dəvə üstündə yaşlı qadın gördüm. Kisra b. Hurmuzun xəzinələrini ələ keçirənlər arasında mən də var idim. Əgər sizin də ömrünüz uzun olarsa Əbul Qasımın xəbər verdiyi kisəsini çıxaran o, adamı görəcəksiniz” dedi[927]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in xəbər verdiyi bu əlamətlər həqiqət olmuşdur. Səhabələrin zamanında İran və Bizansda edilən fəthlərdən sonra mal çoxalmışdır. Ömər b. AbdulƏziz – *rahmətullahi aleyhi* - nin dövründə isə sel kimi

---

[922] Buxari “Cizyə”, “Fəthul Bəri” 6/277.
[923] “Fəthul Bəri” 6/278.
[924] “əl–Bidâyə vən–Nihâyə” 7/94.
[925] Buhari “Fiten” 13/81,82, Müslim “Zəkât” 7/97, Nəvəvi Şərhi.
[926] Müslim “Zekat” 7/96 Nəvəvi Şərhi.
[927] Buhari “Mənakib” 25, Fəthul Bâri 6/610-611.

axmışdır. Belə ki, sədəqə və zəkat veriləcək bir nəfər də belə tapılmamışdır. İbn Həcər – *rahmətullahi aleyhi* - deyir ki: “Böyük ehtimalla İsa və Mehdi - *əleyhimussəllam* - ın dövründə, yəni axır zamanlarda da mal çoxalacaqdır. Doğrusunu Allah bilir”.

**6. *Fitnələrin Ortaya Çıxması:*** Fitnə - Bəlaya düçar olmaq, imtahan olunmaqdır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in bildirdiyi kimi Qəyamətin əlamətlərindən haqq ilə batilin qarışdırıldığı, imanın zərər gördüyü böyük fitnələrin ortaya çıxmasıdır. Belə ki, səhəri mömin olaraq oyanan kimsə axşama kafir olaraq çıxar, mömin olaraq gecələyən kişi səhərə kafir olaraq çıxar. Əbu Musa əl-Əşari - *radıyallahu anhu* – rəvayət edir ki, Mən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Qiyamətdən öncə gecə qaranlığı kimi öldürücü fitnələr ortaya çıxacaqdır. O, fitnələrdə səhər mömin olaraq oyanan kimsə axşama kafir olaraq çıxar. Axşama mömin olaraq çıxan kişi səhərə kafir olaraq oyanar. Oturan ayağda duranda daha xeyirlidir. Ayağda duran isə yeriyəndən, yeriyən isə qaçandan daha xeyirlidir. Oxlarınızı qırın, yaylarınızı qırın. Qılınclarınızın (iti) tərəfini daşa vurun. Əgər sizdən biriniz fitnələrə qarışarsa Adəm - *əleyhissəlam* - ın iki oğlundan ən xeyirlisi (Habil) kimi olun”[928]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Gecə qaranlığı kimi öldürücü fitnələrdən çəkinin. (Xeyirli əməllər etməyə çalışın!) Çünki səhəri mömin olan axşama kafir olacaqdır, axşamı mömin olan isə səhərə kafir olacaqdır. İnsanlar öz imanlarını (dinlərini) dünya malına satacaqlar»[929]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İrəlidə bir çox fitnələr olacaqdır. Bu fitnələr zamanı yatan kimsə, oyaq olandan, oturan kimsə ayaqda durandan, ayaqda duran kimsə yürüyəndən, yürüyən kimsə qaçandan xeyirlidir. Hər kim fitnə vaxtına yetişərsə sığınsın və ya gizlənmək üçün yer taparsa gizlənsin (Başqa rəvayətdə: Dəvəsi olan dəvəsinin yanına, qoyunu olan qoyunlarının yanına, ərazisi olan ərazisinə, bu kimi malları olmayan qılıncını alıb kəskin tərəfini daşa vurub (yaylarnızı qırın) sonra bacardığı qədər sağ qalmağa çalışsın. Ya Rəsulullah! Müharibə edən iki sinifə qatışmayaraq çəkilib bir tərəfdə durduqda biri gəlib məni qılıncı ilə vurub və ya ox atıb məni öldürürsə nə buyurursan? Beləsi həm öz günahı ilə, həm də sənin günahınla yüklənərək Cəhənnəm sahibindən olur)»[930]. Fitnələrlə bağlı hədislər çoxdur. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ümmətini fitnərə qarşı xəbərdarlıq etmiş, onlardan Allaha sığınmalarını əmr etmişdir. Usamə b. Zeyd - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Mədinənin yüksək binalarından birinə çıxaraq: «Mənim gördüklərimi görürsünüzmü?» deyə buyurdu. Səhabələr: «Xeyr» dedilər. O: «Evlərinizin arasına (şiddətli yağan) yağışın (açdığı yaralar) kimi fitnələrin yağdığını görürəm»[931]. Bir nəfər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dedi: «Fitnələr zamanı evimə girib məni öldürmək üçün əlini mənə uzadana nə edim. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Adəm – *əleyhissəlam* – kimi ol! ***«Sən məni öldürməkdən ötrü mənə əl qaldırsan da, mən səni öldürmək üçün sənə əl qaldıran deyiləm. Mən aləmlərin Rəbbi olan Allahdan qorxuram». (əl-Maidə 28)[932].*** Zeyd b. Sabit - *radıyallahu anhu* – rəvayət edir ki, Mən Peyğəmbər –

---

[928] Musnəd 4/408, “Sünən Əbu Davud” 11/334 Avnul-Məbud, “Sünən İbn Məcə” 2/1310, Hakim “Mustədrək” 4/440, əl-Albâni “Câmius Sağir” 2/193, H: 2045.
[929] İmam Nəvəvi “Şərh Müslim” 2/133.
[930] Müslim 2887.
[931] Buxari, Müslim.
[932] Əbu Davud «Fitən» 2.

*sallallahu aleyhi və səlləm* – buyurdu: “Görünən və görünməyən fitnələrin şərrindən Allaha sığınıram”[933].

**7. *Fitnələrin Şərq Tərəfdən Çıxması:*** Müsəlmanlar arasında baş verən fitnələrin çoxu Şeytanın buynuzunun doğduğu yer olan şərq tərəfdən ortaya çıxacaqdır. İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – şərq tərəfə işarə edərək buyurdu: “Diqqət edin! Fitnə oradan, şeytanın buynuzları çıxdığı yerdən gələcəkdir (Başqa rəvayətdə: Küfrün başı bu yerdən şeytanın buynuzunun doğduğu yerdəndir[934])”[935]. İbn Həcər – *rahmətullahi aleyhi* - deyir ki: “İlk çıxan fitnələrin qaynağı şərq tərəfdir və bu müsəlmanların arasında bölünmələrə səbəb olmuşdur. Şeytan bunu çox sevər və bidətin qaynağı da o, tərəfdəndir”[936]. ***Xəvariclər, Əşarilər, Batiniyə, Qədəriyə, Cəhmiyə və Mötəzilə*** kimi sapıq fikirlərin çoxu şərqdən, İraq tərəfdən gəlmişdir. İrandan isə ***Zərdüştlik*** gəlmişdir. ***Bəhailik*** - əsasını qoyan İranlı Mirzə Əli Muhəmməd Şirazidir. İran hökuməti tərəfindən həps edilmiş və öldürülmüşdür. Yerinə ***Bəhaullah*** – Mirzə Hüseyn Əlidir və Peyğəmbərlik iddiasında olmuşdur. Yenə bundan başqa Dəccəl, Yəcuc və Məcuc və s. çıxması şərqdəndir. Bütün bu fitnələrdən Allaha sığınırıq. Sufyan b. Əbu Zubeyr - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Yəmən fəth ediləcəkdir. Bir qrup insan Mədinədən oraya ailələri və onlara tabe olanlarla gedəcəklər. Halbuki Mədinə onlar üçün daha xeyirlidir. Şam da fəth ediləcəkdir. Bir qrup insan Mədinədən oraya ailələri və onlara tabe olanlarla gedəcəklər. Halbuki Mədinə onlar üçün daha xeyirlidir. İraq da fəth ediləcəkdir. Bir qrup insan Mədinədən oraya ailələri və onlara tabe olanlarla gedəcəklər. Halbuki Mədinə onlar üçün daha xeyirlidir”[937].

**8. *Ömər, Osman Və Əli - Radıyallahu Anhum – Un Öldürülməsi*:** Öldürülməsindən sonra səhabə zamanında fitnələr çoxalmağa başladı. Çünki bu hadisə fitnələrə açılan ilk qapı idi. Onun öldürülməsiylə böyük fitnələr başladı, qəlbində iman yerləşməyən fitnəyə dəvət edən insanlar ilə, insanlara gözəl görsənən lakin içində İslamı yıxmaq istəyən münafiqlər çoxaldı. Xuzeyfə - *radıyallahu anhu* – rəvayət edir ki, Ömər - *radıyallahu anhu* – dedi: “Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in fitnə haqqında olan sözünü kim əzbərlədi”. Xuzeyfə: “Mən söylədiyi kimi əzbərlədim” dedim. Ömər: “Sən çox cürətlisən, söylə görüm nə buyurdu” dedi. Mən: “Bir adamın ailəsi, malı, uşağı və qonşusu üzündən düşdüyü fitnəyə namazı, orucu, sədəqəsi, yaxşılığı əmr edib pislikdən çəkindirməsi kəffarə olur” dedi. Ömər: “Mən bunu qəsd etmirdim. Dənizin dalğalanması kimi dalğalanan fitnələri soruşuram” dedi. Mən: “Ey möminlərin əmiri! O, fitnədən sənin üçün bir şey yox. Səninlə o, fitnə arasında qapalı bir qapı var” dedim. Ömər: “Bu qapı qırılacaqmı, yoxsa açılacaq” dedi. Mən: “Qırılacaqdır” dedim. Ömər: “Elə isə bir daha bağlanmaz” dedi. (Ravi deyir ki) Biz Xuzeyfə - *radıyallahu anhu* – dan: “Ömər qapının kim olduğunu bilirdimi?” dedik. O: “Gecənin gəldiyini bildiyi kimi. Mən ona uzaq bir hədisi xəbər verdim” dedi. Biz Xuzeyfə - *radıyallahu anhu* – dan soruşmağa cəsarət etmədik və Məsruk - *radıyallahu anhu* – dan bunu xahiş etdik. O: “Qapı kimdir?” dedi. Xuzeyfə: “Ömər” dedi[938].

---

933 Nəvəvi Şərh, Müslim “Cənnət” 18/203.
934 Nəvəvi Şərhi, Müslim “Fitən” 18/31,32.
935 Fəthul Bəri, Buxari “Fitən” 13/45, Nəvəvi Şərhi, Müslim “Fitən” 18/31.
936 Fəthul Bəri 13/47.
937 Buxari “Fəzailul Mədinə” 5, Müslim “Həcc” 497, 1388.
938 Fəthul-Bəri, Buhari “Mənakib” 6/603-604, Nəvəvi Şərhi Müslim “Fitən” 13/48.

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in buyurduğu həqiqət oldu. Ömər - *radıyallahu anhu* – şəhid edildi və qapı qırıldı. Fitnələr və bəlalar ortaya çıxdı. Rəşidi Xəlifəsi Osman - *radıyallahu anhu* – İraq və Misirdən gələn azğın bir topluluq tərəfindən öldürüldü. Mədinəyə girib Osman - *radıyallahu anhu* – nu evində ikən şəhid etdilər[939].

**9. *Siffin, Cəməl, Həruriyə Döyüşləri:*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Osman - *radıyallahu anhu* – ya başına gələcək bir bəlanın isabət edəcəyini söyləmişdir. Bu üzdən Osman - *radıyallahu anhu* – bu bəlaya səbr etdi və ona görə qan tökülməsin deyə azğın topluluğa qarşı çıxması üçün səhabəyə izin vermədi[940]. Əbu Musa əl-Əşari - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına Osman - *radıyallahu anhu* – gəldi və yanına girmək üçün izn istədi. Peyğəmbər: "İzn verin gəlsin və Ona isabət edəcək bir bəladan dolayı Cənnətə girəcəyini də müjdələyin" deyə buyurdu[941]. Osman - *radıyallahu anhu* – nun öldürülməsiylə müsəlmanlar qruplara ayrıldılar və səhabələr arasında savaşlar oldu. Fitnələr və sapıq görüşlər yayıldı, ayrılıqlar çoxaldı. Bunun nəticəsində səhabə zamanında sonu heç də yaxşı olmayan döyüşlər baş verdi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – səhabə zamanında olacaq fitnələri bilirdi. Usamə b. Zeyd - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Mədinənin yüksək binalarından birinə çıxaraq: «Mənim gördüklərimi görürsünüzmü?» deyə buyurdu. Səhabələr: «Xeyr» dedilər. O: «Evlərinizin arasına (şiddətli yağan) yağışın (açdığı yaralar) kimi fitnələrin yağdığını görürəm»[942]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əli - *radıyallahu anhu* – ya, onunla Aişə - *radıyallahu anhə* – arasında hadisənin olacağını xəbər vermişdi. Əbu Rafidən gələn hadisdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əli - *radıyallahu anhu* – ya buyurdu: "Səninlə Aişə - *radıyallahu anhə* – arasında bir hadisə baş verəcəkdir?". Əli: "Mənimləmi ya Rəsulallah?" dedim. Peyğəmbər: "Günahkar mənmi olacağam ya Rəsulullah?" dedim. Peyğəmbər: "Xeyr, lakin belə bir şey olarsa onu əmin olacaq bir yerə götür" deyə buyurdu[943]. İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – xanımlarına buyurdu: "Sizlərdən biri tüklü bir dəvəyə minər və Həvəbin (Məkkə ilə Bəsrə yolu üzərində Bəsrəyə yaxın bir yerdir. Cahiliyyə vaxtında ərəblər sularını buradan götürərdilər[944]) itlərinin hürdüyü yerə qədər gələr. Sağında və solunda çoxlu ölülər olur. O, da öldürülməkdən qurturulu"[945]. Aişə - *radıyallahu anhə* – Bəni Amir məntəqəsinə gəldiyi zaman köpəklər üzərinə hürməyə başladılar. Aişə: "Bu haranın suyudur?" dedi. Ona: "Bu Həvbədir" dedilər. Aişə: "Zənn edirəm ki, dönmək lazımdır. Çünki Peyğəmbər: "Siz qadınlardan biri Həbvənin köpəkləri üzərinə hürdüyü zaman halı necə olur" dediyini eşitdim[946]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İki böyük İslam ordusu bir-biri ilə savaşmadıqca Qiyamət qopmaz. Bu iki toplumun ikisi də eyni iddiada olduqları (ikisi də İslamiyyət və haqq iddiasında olduqları) halda aralarında böyük savaş

---

939 "Bidayə" 8/180–191.
940 "əl-Avasim minəl-Qavasim" s: 132-137.
941 Fəthul Bəri, Buhari "Fitən" 13/48.
942 Buxari, Müslim.
943 Müsnəd 6/393, Kənzul-Ummal, "Fəthul-Bəri" 13/55, Heysəmi "Məcmuaz-Zəvaid" 7/234.
944 "Mucəmul-Buldan" 2/314.
945 "Fəthul-Bəri" 13/55, Əhməd, Əbu Yəla, Bəzzar, İbn Hibban, Həkim, əl-Albani "Səhihdə" 1/4, 5/223,233, H.475.
946 "Mustədrək" 3/120, "Fəthul-Bəri" 13/55, Heysəmi "Məcmauz-Zəvaid" 7/234, "Musnəd" 6/52.

olacaqdır...”[947]. İbn Həcər – *rahmətullahi aleyhi* - deyir ki: “Bu iki topluluqdan biri Əli - *radıyallahu anhu* – və onunla birlikdə olanlardır, digəri isə Muaviyə - *radıyallahu anhu* – və onunla birlikdə olanlardır”[948]. Bu iki toplum arasında Siffin adlanan yerdə Hicri **36**-cı ildə Zil Hiccə ayında döyüş baş verdi. Döyüşdə hər iki tərəfdən **70000** minə yaxın insan öldü. Zeyd b. Vəhb rəvayət edir ki: “Biz Xuzeyfə - *radıyallahu anhu* – nun yanında idik. O: “Din, Din qardaşlarımız çıxmış və bir-birilərinə qılınc qaldırmışlar. Siz nə düşünürsüz?” dedi. Biz: “Sən nə etməmizi əmr edirsən” dedik. O: “Əli - *radıyallahu anhu* – nun tərəfində olan qrupu tapın və onlarla olun. Çünki haqlı olan Əli - *radıyallahu anhu* – dur” dedi[949].

***Xaricilər*** - Əli - *radıyallahu anhu* – ya qarşı çıxmalarıdır. Abdullah b. Şəddaf b. əl-Hadi rəvayət edir ki: «Sayı **12** minə yaxın, qəlbində mərəz olan Xəvariclər Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in yolu ilə gedən Əlinin başçılıq etdiyi cəmaatdan Kufədən **2** mil uzaqlıqda olan Hərura adlanan yerdə ayrılıb, ona qarşı çıxdılar və Əli - *radıyallahu anhu* – nu kafir saydılar. Əli - *radıyallahu anhu* – ilə Muaviyə - *radıyallahu anhu* – arasında döyüş uzandığı təqdirdə Muaviyə - *radıyallahu anhu* – nun tərəfdarları Quranın müshaflarını nizələrin ucuna taxaraq Əli - *radıyallahu anhu* – nun tərəfdarlarını Qurana tabe olmağa çağırdılar. Bizdən bir adam, sizdən də bir adam çıxardaq dedilər. İnsanlar buna razı olduqda Muaviyə - *radıyallahu anhu* – tərəfdən Amr b. As - *radıyallahu anhu* –, Əli - *radıyallahu anhu* – tərəfdən isə Əbu Musa əl-Əşari - *radıyallahu anhu* – çıxdı. Lakin Əli - *radıyallahu anhu* – İbn Abbas - *radıyallahu anhu* – nun çıxmasını istəyirdi. Lakin bunu görən Urvə b. Uzeynə: «Allahın əmrində adamlarınızı hakim təyin edirsiniz, hökm ancaq Allahındır – deyərək döyüş hazırlığını görməyə başladılar. Əli - *radıyallahu anhu* – nəsihət etmək üçün İbn Abbas - *radıyallahu anhu* – nu onların yanına göndərdi. Bunlar da İbn Abbas - *radıyallahu anhu* – ilə Allahın kitabı üzərində üç gün mübahisə etdilər. Nəhayət onlardan 8 (4) min kişi geri döndü». Əbu Səid əl-Xudri - *radiyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – qənimətləri payladığı zaman Bəni Təmim qəbiləsindən olan Zul Xuveysra adlı bir nəfər gəldi və: «Ey Allahın Rəsulu adil ol!» dedi. Peyğəmbər: «Vay sənin halına! Əgər mən adil olmasam kim adil ola bilər! Əgər mən adil olmasaydım (sən mütləq adil olmayan bir insana tabe olduğun üçün) əliboş qalardın və zərər çəkənlərdən olardın» deyə buyurdu. Ömər: «Ey Allahın Rəsulu! İzin ver boynunu vurum» dedi. Peyğəmbər: «Onu tərk et, onun kimi onun dostları vardır ki, sizdən biriniz öz namazını onların namazı yanında, öz orucunu onların orucu yanında kiçik görər. Onlar Quranı oxuyacaqlar, lakin Quran onların boğazlarından aşağı enməyəcəkdir, onlar İslamdan oxun şikardan çıxması kimi çıxacaqlar. (Başqa rəvayətdə: Ox şikarın bədənini sürətlə deşib çıxdığı kimi dindən çıxacaqlar). Ovçu oxunun dəmirinə baxar orada qandan bir əlamət görməz, oxun taxta hissəsinə baxar yenə də orada bir əlamət tapmaz. Onların əlaməti qolu qadın döşü və ya yellənən ət parçası kimi olan qara kimsədir. Onlar (müsəlmanlar) arasında ayrılığ düşdüyü zaman ortaya çıxarlar. Onları iki tayfadan haqqa ən yaxın olanı öldürər» deyə buyurdu[950]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Axır zamanda bir qövm çıxacaqdır ki, onlar Quranı oxuyacaqlar, lakin Quran onların boğazlarından aşağı

---

[947] Fəthul-Bərî, Buxari “Fitən” 13/8, Nəvəvî Şərhi, Müslim “Fitən” 13/12-13.
[948] “Fəthul-Bərî” 13/85.
[949] “Fəthul-Bəri” 13/85.
[950] Buxari 5057, 6930, Müslim 1066.

enməyəcəkdir, onlar İslamdan oxun şikardan çıxması kimi çıxacaqlar. Onların əlamətləri başlarını qırxmaq olacaqdır. Onlar həmişə mövcud olacaqlar. Onların axırıncısı Dəccəllə bərabər çıxacaqdır. Onlar məxluqatın ən şərlisi və ya məxluqatın ən şər təbəqəsidir. Onlarla qarşılaşdığınız zaman onları öldürün»[951].

**10.** ***Yəhudi Və Xristiyanlar Kimi Keçmiş Ümmətlərin Yolu Ilə Getmək:*** Fitnələrdən biri də Yəhudi və Xristianların adətlərinə uymaq və onları təqlid etməkdir. Bəzi müsəlmanlar kafirləri təqlid etməkdə, onlara bənzəməkdə, onların əxlaqı ilə əxlaqlanmaqda və onları sevmələridir. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həqiqətən siz əvvəlkilərin (sünnəsi – yolu), adət ən-ənələrilə gedəcəksiniz. Hər bir şeydə onlara qarış-qarış oxşamağa çalışacaqsınız. O, dərəcəyə qədər ki, onlardan biri kərtənkələ yuvasına girsə belə siz də onun ardınca girəcəksiniz». Biz: «Ya Rəsulullah! Sən Yəhudi və Xristianları nəzərdə tutursan?» deyə soruş-duq. Peyğəmbər: «Onlardan başqa kimlər olacaq» deyə buyurdu[952].

**11.** ***Yalançıların Və Peyğəmbərlik İddiasında Olanların Ortaya Çıxması:*** Ortaya çıxan əlamətlərdən biri də **30** yaxın yalançının Peyğəmbərlik iddiasında olmasıdır. Onlardan bəziləri Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – həyatda ikən və səhabə zamanında ortaya çıxmış, günümüzdə də ortaya çıxmağa davam edir[953]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “**30** yaxın yalançı çıxmadıqca Qiyamət qopmaz. Bunların hamısı Peyğəmbər olduqlarını iddia edəcəklər” [954]. Səvban - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ümmətimdən olan qəbilələr bütlərə tapınaraq müşriklərə qatılmadıqca Qiyamət qopmaz. Şübhəsiz ki, mənim ümmətimdən otuza yaxın yalançı çıxacaq. Onların hər birisi bir Peyğəmbər olduğunu iddia edəcəkdir. Mən isə Peyğəmbərlərin sonuncusuyam. Məndən sonra Peyğəmbər yoxdur»[955]. Bu yalançılardan biri olan Musəyləmə Kəzzəb Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in həyatının son zamanlarında ortaya çıxmış və Peyğəmbərlik iddiasında olmuşdur. Peyğəmbər onunla yazışmış və Onu Kəzzəb olaraq adlandırmışdır. Ətrafına çox adam toplamış və müsəlmanlara çox pisliklər etmişdir. Nəhayət Əbu Bəkr - *radıyallahu anhu* – nun dövründə Yəməmə döyüşündə öldürülmüşdür. Daha sonra Yəməndən Əsvəd b. əl-Ənəsi Peyğəmbərlik iddiasında olmuş və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – vəfat etmədən öncə səhabə tərəfindən öldürülmüşdür. Yenə Səcah ismində Peyğəmbərlik iddiası edən qadın olmuş. Museyləmə ilə evlənmişdir. Lakin Museyləmə öldürüldükdə təkrar İslama qayıtmışdır. Daha sonra Zuleyha b. Xuveylid əl-Əsədi Peyğəmbərlik iddiasında olmuş daha sonra Tövbə edərək İslama dönmüşdür. Yenə də onlardan biri Həris əl-Kəzzəbdir. AbdulMəlik b. Mərvan xəlifəliyi zamanında öldürülmüşdür. Abbasi xəlifələri dövründə də bir çox yalançı Peyğəmbərlər çıxmışdır. Son əsirlərdə isə Hindistanda Mirzə Əhməd Qadyani ortaya çıxmış. Gözlənilən Peyğəmbər, Məsih olduğunu və İsa - *əleyhissəlam* - ın qeybə çəkilmədiyini və s. iddialarda olmuşdur. Səmura b. Cundəb - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – günəş

---

[951] Musnəd 4/421, Nəsəi 7/119-121, Bəzzar «Musnəd» 9/294, Həkim «Mustədrək» 2647, əl-Albani zəif.

[952] Buxari, Müslim, Əbu Davud 4333, 4334, Tirmizi 2219.

[953] “Fəthul-Bâri” 6/617.

[954] Fəthul-Bəri, Buxarî “Mənâkib” 6/616, Nəvəvi Şərhi, Müslim “Fitən” 18/45-46.

[955] Buxari, Müslim, Əbu Davud 4252, Musnəd 5/278, “Avnul-Mabûd” Şərhi, Ebu Davud 11/324, “Tuhfetul Ahvəzî” şərhi, Tirmizi 6/466, əl-Albani “Camius Sağir” 6/174, H.7295.

tutulduğu zaman verdiyi xütbəsində buyurdu: “**30** nəfər yalançı çıxmadıqca Qiyamət qopmaz. Onların sonuncusu tək göz Dəccəldir”[956]. Xuzeyfə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Ümmətimdən **27** nəfər yalançı dəccəl çıxacaq. Onlardan **4** qadındır. Mən isə Peyğəmbərlərin sonuncusuyam. Məndən sonra Peyğəmbər yoxdur”[957].

**12.** ***Əminliyin Artması***: Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “İraq ilə Məkkə arasında səfər edən kimsə yolu azmaqdan başqa heç bir şeydən qorxmadığı müddətdə Qiyamət qopmaz”. Səhabə zamanında müsəlmanların fəth etdiyi yerdə İslam və ədalət olduğu üçün bu hallar baş vermişdir. Mehdi və İsa - *əleyhissəlam* - ın zamanında da yer üzü ədalət və əmin-amanlıqla dolacaqdır. ***İsnşəallah!***

**13.** ***Hicazdan Alovun Çıxması***: Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hicaz bölgəsində bir atəş çıxmadıqca Qiyamət qopmaz. Bu atəş Busradakı dəvələrin boyunlarını işıqlandıracaqdır»[958]. Bu atəş **7**-ci əsrin ortalarında **654**-cü ildə görsənmişdir. İmam Nəvəvi – *rahmətullahi aleyhi* - deyir ki: “Bizim zamanımızda **654**-cü ildə Mədinədə bir atəş çıxdı. Mədinənin doğu tərəfində Harrənin arxasında böyük bir alov idi. Bu atəşi Şam və s. bölgələr görmüşdülər. Bu atəşin necə olduğunu Mədinəlilər mənə xəbər vermişdilər”[959]. İbn Kəsir – *rahmətullahi aleyhi* - deyir ki: “Busrada olan bədəvilərin bir çoxu Hicazda çıxan bu atəşin dəvələrin boyunlarını işığlatdığına şahid olmuşdular”[960]. Qurtubu – *rahmətullahi aleyhi* - deyir ki: “Məkkə və Busra dağlarından atəşin göründüyünü söyləmişdir”[961].

**14.** ***Türklərlə Döyüş*****:** Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Siz ayaqqabıları keçə (dəridən) olan, gözləri kiçik, üzləri qırmızı, burunları kiçik (basıq), üzləri dəri ilə örtülmüş (dəri üstünə dəri örtülmüş qalxan kimi qalın dərili) olan Türklərlə savaşmadıqca Qiyamət qopmaz»[962]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Müsəlmanlar Türklərlə döyüşmədikcə Qiyamət qopmaz. Onlar üzlərini dəri ilə örtmüş bir qövmdür. Tükdən (dəridən) paltar və ayaqqabı geyinərlər”[963]. Amr b. Sələbə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Geniş üzlü, elə bil ki, dəri üstünə dəri örtünmüş qalxan kimi qalın dərili bir qövmlə sizin döyüşünüz Qiyamətin əlamətlərindəndir”[964]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Siz Əcəmilərdən (ərəb olmayan) Huz (İranda yerləşən Əhvəzdə bir yerdir) və Kirmanla (Bir çox kənd və qəsəbəsi olan geniş bir ərazidir. Qərbində İran, Şərqində Xorasan, Cənubda isə İran dənizi vardır) döyüşmədikcə Qiyamət qopmaz.

[956] İbn Hibban 7/102, Həkim 1/479, Beyhəqi 3/397, Müsnəd 5/16.
[957] Müsnəd 5/396, Təbərani 3026, “Əvsat” 5/327, Fəthul Bəri 13/87, “Cəmiu-Sağır” 4/97, H. 4134, Heysəmi “Məcmauz-Zəvaid” 7/332,532.
[958] Buxari «Fitən» 24, Müslim «Fitən» 42.
[959] Müslim Nəvəvi Şərhi 18/28.
[960] “Bidâyə Və Nihâyə” 1/14, 13/187-193.
[961] Təzkira” s:636.
[962] Fəthul Bəri 6/604, Buxari “Mənakib” 25, “Cihad” 95, Müslim “Fitən” 62, 2912, Əbu Davud 4303, Tirmizi 2216.
[963] Nəvəvi Şərhi, Müslim “Fitən” 18/37.
[964] Musnəd 5/70.

Onlar qırmızı üzlü, basıq burunlu, kiçik gözlüdürlər. Üzləri dəri üzərinə dəri örtülmüş kimi qalın dərili (ətli) və ayaqqabıları tüklüdür (dəridəndir)”[965].

**15.** ***Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – Haqqında Hədislərin Uydurulması***: Əli, Ənəs b. Məlik, Əbu Hureyrə - *radıyallahu anhum* – rəvayət edirlər ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şübhəsiz ki, mənim ağzımdan yalan söyləmək başqasının ağzından yalan söyləmək kimi deyil. Hər kim söyləmədiyimi mənə qəsdli olaraq söyləyərsə atəşdən yerini hazırlasın»[966].

**16.** ***Təhlükəsizlik Orqanları:*** Əbu Umamə - *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Axır zamanda bu ümmət üçün əlində öküz quyruğu kimi qamçı olan adamlar çıxacaqdır. Gəlir əzab edər, gedir (yenə də) əzab verərlər (Başqa rəvayətdə: “Axır zamanda insanlara səhər axşam əzab verəcək təhlükəsizlik dəstələri (orqanları) olacaq. Onlardan olmayasan”[967]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cəhənnəm əhlindən iki sinif insan var ki, mən onları dünyada ikən görməmişdirm. Bir qövm inəyin quyruğu kimi qamçılarla insanları döyərlər. İkincisi isə qadınlar açıq-saçıq, yarım çılpaq geyinəcəklər, pozğun şeylərə meyl edəcəklər, başlarını (saçlarını) dəvənin boynundakı hörüklər kimi maili çıxacaqlar. Onlar Cənnətə daxil olmazlar və onun iyisini də duymazlar. Halbuki cənnətin iyi bu və bu qədər məsafədən hiss edilir»[968]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Əgər ömrün uzun sürərsə çox keçməz ki, əlindəki öküz quyruğu kimi qamçılar olan qrupun insanlara durmadan əzab etdiklərini görəcəksən”[969]. İbn Abbas – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Sizin başınıza elə bir təhlükəsizlik orqanları gəlir Məcusilərdən daha pis olacaqlar”[970].

**17.** ***Yalanın Artması***: Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamətə yaxın mənim ümmətimdən elə bir insanlar çıxacaq ki, onlar nə sizin, nə də atalarnızın eşitmədikləri şeyləri danışacaqlar. Onlardan çəkinin»[971]. Abdullah b. Amr - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dənizdə Süleymanın qandalladığı şeytanlar vardır. Çox keçməz ki, onlar azad olarlar və insanlara öz Quranlarını oxuyarlar»[972].

**18.** ***Elmin Qaldırılması, Cahillik Və Fitnə-Fəsadın Çıxması:*** Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamətə yaxın elm qaldırılacaq (cahillik yayılacaqdır)»[973]. Şakik deyir ki, mən İbn Məsud və Əbu Musa - *radıyallahu anhum* – ilə birlikdə idim. Onlar Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in belə buyurduğunu rəvayət etdilər: “Qiyamətdən öncə elə bir günlər gələcək ki, elm qaldırılacaq, cahillik isə artacaqdır”[974]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu:

---

[965] Fəthul-Bəri, Buxari “Mənâkib” 6/604.
[966] Müslim.
[967] Musnəd 5/250, “Camius Sağir” 13/317, H. 3560.
[968] Nəvəvi şərhi, Müslim “Cennet ve Sifati” 17/190.
[969] Nəvəvi şərhi, Müslim “Cennet ve Sifati” 17/190.
[970] Təbərani “Sağir” və “Əvsat” “Məcmauz-Zəvâid” 5/235.
[971] Nəvəvi şərhi, Müslim “Müqəddimə” 1/78.
[972] Nəvəvi şərhi, Müslim “Müqəddimə” 1/79-80.
[973] Fəthul-Bəri, Buhari “Elm” 1/178, Nəvəvi Şərhi, Müslim “Elm” 16/222.
[974] Fəthul-Bəri, Buxari “Fitən” 13/13.

“Zaman qısalır, elm qaldırılır, fitnələr ortaya çıxır, simiclik artır və ölüm çoxalır”[975]. İbn Batta – *rahmətullahi aleyhi* - deyir ki: “Biz bu hədisdə söylənilən Qiyamətin əlamətlərindən elmin azaldığını, simicliyin artdığını, cahilliyin çoxaldığını, fitnələrin ortaya çıxdığını və ölümün çoxaldığını günümüzdə açıq-aydın görürük”[976]. İbn Həcər – *rahmətullahi aleyhi* - deyir ki: “Bu kimi şeylər gələcəkdə daha da artacaqdır. Elmin qaldırılmasıyla birlikdə cahilliyin yayılması buna işarədir. O, anda alimlərin olması bu hadisələrin baş verməsinin qarşısını ala bilməyəcəkdir. Çünki o, vaxt cahillər alimləri başa düşməzlər”[977]. Abdullah b. Amr b. əl-As - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Həqiqətən də Allah elmi insanlardan almaz. Lakin elmli insanların ruhlarını almaqla elmi onlardan qaldırar. Beləki heç bir alim qalmadıqda insanlar özləri üçün cahilləri başçılar təyin edərlər. Onlar da sual verildikdə elmsiz olaraq fətva verərlər. Bununla həm özləri zəlalətə düşər, həm də başqalarını zəlalətə salarlar”[978]. Burada olan elmdən qəsd Quran və Sünnədi. O, da Peyğəmbərlərin miras olaraq buraxdıqları elmdir. Çünki alimlər Peyğəmbərlərin varisləridir. Onların yox olmasıyla elm də yox olar, sünnətlər unudular, bidətlər çoxalar və cahillik artar. Bu ümmətin alimləri səhabələr, tabiinlər və onlara tabe olanlardır. Ən xeyirli əsr onların zamanı idi. İmaran b. Hüseyn - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ümmətimin ən xeyirliləri mənim zamanımdakılardır. Sonra onların ardıyca gələnlərdir». Səhabə deyir ki, bilmirəm iki, yoxsa üç nəsil zikr etdi…»[979]. Elm azalmağa davam etdikcə cahillikdə çoxalır. Huzeyfə b. Yəmən - *radıyallahu anhu* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü İslam paltarın naxışları silinib yox olduğu kimi silinib yox olacaqdır. Belə ki, (yer üzündə) nə orucun, nə namazın, nə həccin, nə də sədəqənin nə olduğu bilinməyəcəklər. Allah bir gecədə Quranı qaldıracaq və yer üzündə ondan bir ayə belə qalmayacaqdır. O, zaman insanlardan yaşlılar və böyüklər qalacaqlar və deyəcəklər: «Biz babalarımızın bu kəlməni: «***Lə İləhə İlləllah***» - söylədiklərini eşitdik. Buna görə də biz də onu söyləyirik». «Bu sözlər onları Cəhənnəmdən qurtaracaq» və üç dəfə təkrar etdi»[980]. Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yer üzündə Allah, Allah kəlməsi itməyənədək Qiyamət qopmaz»[981]. İbn Kəsir – *rahmətullahi aleyhi* - deyir ki: “Bu hədisin iki mənası vardır: 1. Kimsə pislikdən çəkindirməz., pisliyi edən bir kmsəni gördüyü zaman ona mane olmaz. Buna görə də: Allah, Allah! Deyilməz. 2. Allah bilinməz, yer üzündə adı belə çəkilməz. Bu da insanlığın yox olduğu, inkar, üsyan, fitnə, fəsadın çox olduğu zamanda olur”[982]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yer üzündə ***Lə İləhə İlləllah*** deyildiyi müddətdə Qiyamət qopmayacaqdır»[983]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah, Allah deyən bir adamın üzərinə Qiyamət

---

[975] Nəvəvi Şərhi, Müslim “Elm” 16/222,223.
[976] “Fəthul-Bəri” 13/16.
[977] “Fəthul-Bəri” 13/16.
[978] Buxari 100, Müslim 2673.
[979] Buxari, Nəvəvi Şərhi, Müslim «Fitən» 42, “Səhabənin Fəzilətləri” 16/86.
[980] İbn Məcə 4049, Həkim 8460, 8646, İbn Həcər «Fəthul Bəri» 13/16, əl-Albani «Səhih Hədislər Silsiləsi» 87, “Səhih Cəmius Səğir» 7933,8077.
[981] Nəvəvi Şərhi, Müslim “İmân” 2/187.
[982] “Nihayə” 1/186.
[983] Əhməd 3/268.

qopmayacaqdır»[984]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Zaman içində bir gün olsun belə ***Lə İləhə İlləllah*** deyən kimsə şübhəsiz ki, Cəhənnəmdən çıxacaqdır»[985]. İbn Məsud - *radıyallahu anhu* – deyir ki: "Quran aranızdan qaldırılaraq bir gecədə yox olur və insanların qəlblərindən gedər. Ondan heç bir əsər-əlamət qalmaz"[986].

**19. *Ölüm Hadisələrinin Artması:*** Auf b. Məlik, İbn Ömər - *radıyallahu anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günündən qabaq altı hadisəni gözləyin: «Ümmətimin ölüm xəstəliyinə tutulmasıdır. Belə ki, qoyun qırxarkən yunlarının yerə düşdüyü kimi insanlar da yerə düşüb öləcəklər»[987]. İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Qiyamətdən öncə ***Xarc*** günləri gəlir. O, günlərdə elm yox olur, cəhalət çoxalır" dedi. Əbu Musa: "***Xarc*** - Həbəşi dilində mənası adam öldürməkdir" dedi[988]. Əbu Hureyrə, Əbu Musa əl-Əşari - *radıyallahu anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamətə yaxın ***Xarc*** çoxalacaqdır» Biz: «***Xarc*** nə deməkdir?» deyə soruşduq. O: «Ölüm hadisələrinin çoxalması, adam öldürməkdir)». Səhabə: "Biz bir ildə (döyüşlərdə) **70** mindən çox adam öldürürük. Bundan daha çox öldürücəyik?" dedi. Peyğəmbər: "Bu sizin müşrikləri öldürməyiniz deyildir. Bu sizin bir-birinizi öldürməyinizdir" deyə buyurdu. Səhabə: "Bunu etdiyimiz zaman ağlımız yerində olurmu?" dedi. Peyğəmbər: "O, gün insanların çoxunun ağlı yerində olmaz. Onların yerinə boş başlı insanlar gəlir. Hamısı özlərini (böyük, alim) sayarlar. Lakin onlar heç bir şeydirlər" deyə buyurdu[989]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qəlbim əlində olan Allaha and olsun ki, ölən nə üçün öldürdüyünü, öldürülən də nə üçün öldürüldüyünü bilmədikcə Qiyamət qopmaz». Biz: «Bu necə olacaq?» deyə soruşduq. O: «Bu elə qətllər olacaq ki, ölən də öldürülən də Cəhənnəmə düşəcək»[990]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Zaman qısalacaq, elm yox olacaqdır. Fitnələr meydana gələcəkdir. ***Karğaşa*** çoxalacaqdır». Səhabələr: «***Karğaşa*** nədir? Ya Rəsulallah!» dedilər. Peyğəmbər: «Öldürmədir, öldürmə! (Başqa rəvayətdə: «***Karğaşa*** – insan yanında əyləşən yoldaşına güvənməyəcəkdir)»[991]. İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü Allahın ilk haqq-hesab etdiyi şey qanla əlaqəsi olan şeylərdir»[992]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «***Xarc*** və ***Mərc*** vaxtlarında edilən ibadət mənim yanımda hicrət etmək kimidir»[993]. Sadaqa b. Musənna Rabah b. Həris, Əbu Burdə - *radıyallahu anhu* – yolu ilə gələn hədisdə deyir ki: "Ziyadın əmirliyi zamanı bazarda olarkən dəhşətdən əlimi digərinin içinə çırpdım. Ənsardan atası səhabə olan biri: "Nə üçün belə təəccübləndin ey Əbu Burdə?" dedi. Mən: "Dini bir, Peyğəmbər bir, döyüşü bir, Həcci bir, döyüşdükləri bir olan qövm bir-

---

[984] Əhməd 3/162.
[985] Əhməd 3/29.41.
[986] Təbərâni, Heysəmi "Məcmauz-Zəvâid" 7/329-330, İbn Hacər "Fəthul-Bəri" 13/16.
[987] Buxari «Cizyə» 15.
[988] "Fəthul-Bəri", Buxari "Fitən" 13/14.
[989] Nəvəvi Şərhi, Müslim "Fitən" 18/13, Musnəd 4/414, İbn Məcə "Fitən" 2/1309 H. 3959, Şərhus-Sünnə 15/28-29 H. 4234, əl-Albani "Camius-Sağir" 2/193, H. 2043.
[990] Nəvəvi Şərhi, Müslim "Fitən" 18/35.
[991] Buxari, Müslim.
[992] Buxari, Müslim.
[993] Müslim.

birilərini öldürməyi necə halal sayırlar?” dedim. Mənə: “Heç təəccüblənmə. Atam mənə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in belə buyurduğunu rəvayət etdi: “Mənim ümmətim bağışlanmış bir ümmətdir. Axirətdə hesab və əzab görməzlər. Onların əzabı öldürmə, zəlzələ və fitnədir”[994].

**20.** ***Qəbirdəkilərə Qibtə Edilməsi:*** Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət qopmaz o, vaxta qədər ki, qəbrin yanından keçən insanlar – «Kaş ki, onun yerində mən olaydım» deməyincə[995]. Xuzeyfə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnsanlar üçün elə bir zaman gələcək ki, Dəccəlin çıxmasını istəyəcəklər”. Mən: “Nə üçün Ya Rəsulullah!” dedim. Peyğəmbər: “Çətinlik və sıxıtlırlarla üzləşdikləri üçün” deyə buyurdu[996].

**21.** ***Bəlaların Və Fitnələrin Artmasından İnsanın Ölmüş Birisinin Yerində Olmasını Təmənna Etməsi:*** Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ruhum əlində olan Allaha and olsun! İnsan qəbrin yanından keçərkən (borca görə deyil sadəcə bəlalara görə) özünü toza çırpıb – «Kaş ki, qəbrdə mən olardırm» deməyincə Qiyamət qopmaz[997]. İbn Məsud - *radıyallahu anhu* – deyir ki: “Sizin üzərinizə elə bir zaman gələcək əgər sizdən birisi ölümü tapsa onu alar. Şairin dediyi kimi: “Bu həyatın dadı qalmadı, ölümü satan varsa mən alım onu”[998].

**22.** ***Ani Ölümün Artması:*** Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «...Ani ölümün çoxalması Qiyamətin əlamətlərindəndir”[999].

**23.** ***Zəlzələlərin Və Xəstəliklərin Çoxalması***: Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Zəlzələlərin sayı çoxalmadıqca Qiyamət qopmaz»[1000]. Sələmə b. Nufeyl əs-Səkuni - *radıyallahu anhu* – deyir ki, biz Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanında oturmuşduq... Qiyamətdən öncə yoxlucu xəstəliklər olacaq. Sonra isə illərlə zəlzələlər sürər” deyə buyurdu[1001]. Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər hansı bir qövmdə zinakarlıq artarsa Allah onları taunla və başqa bir xəstəliklə cəzalandırar. Elə bir xəstəlik ki, bundan qabaq bu haqda eşitməyiblər»[1002].

**24.** ***Kişilərin Sayca Azalması Və Qadınların Çoxalması***: Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, sizə bir hədis söyləyəcəyəm. Onu məndən başqa kimsə sizə başa salmaz. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in belə buyurduğunu eşitdim: “Elmin azalması, cahilliyin artması, qadınların çoxalması, kişilərin azalması Qiyamətin əlamətlərindəndir. Belə ki, bir kişiyə **50** qadın düşər”[1003]. Əbu Musa - *radıyallahu anhu* – rəvayət edir ki: “Qırx qadının bir kişiyə tabe olduğunu və onu saxladığı görülür”[1004].

---

[994] Həkim “Mustədrək” 4/253-254, “Səhih Hədislər” 2/684-686, Musnəd 4/410, “Camius-Sağir” 2/104, H. 1734. “Səhih Hədislər” 2/684, H. 959.
[995] “Fəthul-Bəri”, Buxarî “Fitən” 13/81,82, Nəvəvi şərhi, Müslim “Fitən” 18/34.
[996] Təbərâni “Əvsat”, “Məcmauz-Zəvâid” 7/284-285.
[997] Nəvəvi şərhi, Müslim “Fitən” 18/34.
[998] “Feyzul-Kadir” 6/418.
[999] Heysəmî “Məcmauz-Zəvâid” 7/325, “Təbərâni “Sağir” və “Əvsat”, əl-Albâni “Camius-Sağir” 5/214, H. 5775.
[1000] “Fəthul-Bəri”, Buxari “Fitən” 13/81,82.
[1001] Musnəd 4/104, Heysəmi “Məcmauz-Zəvaid” 7/306.
[1002] İbn Məcə.
[1003] Fəthul-Bəri, Buxari “Elm” 1/178, Nəvəvi şərhi, Müslim “Elm” 16/221, Tirmizi 6/448, H. 2301.
[1004] “Fəthul-Bəri” 1/179.

**25.** ***İnsanların Göz Qabaqlarında Zinanın Artması***: Nəvvas b. Səman - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və sələm* – buyurdu: «Yer üzündə insanların şərliləri qalar. Onlar orada heç bir kəsdən utanmadan eşşəklərin bir-biri ilə cinsi əlaqədə olduqları kimi qadın kişi bir-birləri ilə cinsi əlaqədə olarlar. Qiyamət də onların üzərində qopar»[1005]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qəlbim əlində olan Allaha and olsun! Bu ümmət məhv olmaz o, vaxta qədər ki, bir kişi qadını yolda uzada və o, günün ən xeyirli insanları isə: «Yaxşı olardı ki, sən o divarın arxasında gizlənərdin» deyəcəklər[1006].

**26.** ***İçkinin, Zinanın Artması Və Bunların Halal Qəbul Edilməsi:***. Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamətə yaxın zinakarlığın, içkilərin artması (çoxalması) olacaqdır»[1007]. Əbu Məlik əl-Əşari - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ümmətimdən zinanı, ipəyi, içkini və musiqi alətlərini halal qəbul edən insanlar çıxacaq»[1008]. Səhl b. Səd - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamətə yaxın pozğunluq, iflas və çirkinlik baş alıb gedəcəkdir». Biz: «Ey Allahın Rəsulu! Bu nə vaxt olacaqdır?» deyə soruşduq. O: «Musiqi alətlərinin və qadın müğən-nilərinin çoxaldığı vaxt!» deyə buyurdu[1009]. Ubadə b. Sabit - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ummətimdən bir qism insanlar olacaq ki, içki içib onu başqa adla adlandıracaqlar»[1010].

**27.** ***Musiqi Və Çalğı Alətlərinin Çoxalması:*** Səhl b. Səd - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamətə yaxın pozğunluq, iflas və çirkinlik baş alıb gedəcəkdir». Biz: «Ey Allahın Rəsulu! Bu nə vaxt olacaqdır?» deyə soruşduq. O: «Musiqi alətlərinin və qadın müğənnilərinin çoxaldığı vaxt!» deyə buyurdu[1011]. Ənəs b. Məlik, İmran b. Huseyn - *radıyallahu anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bu ümmətin içərisində yerə batırılma (yəni zəlzələ), göydən daş yağma və surət dəyişməsi (heyvana çevrilmə) olacaqdır. Səhabələr: «Nə zaman Ey Allahın Rəsulu?» deyə soruşdular. Nə vaxt ki, içki içiləcək, qadın müğənnilər (cariyələr) və musiqi alətləri (***Ud***) (***Bərabit*** – Uda bənzəyən (simli alət) bir çalğı alətidir. Buna səbəb bunu çalan kimsənin bu aləti köksünün üzərinə qoymasıdır. Köks də ***Bər*** deməkdir) zühur edəcəkdir»[1012].

**28.** ***Faizin (Sələmçiliyin) Çoxalması:*** İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Qiyamətdən öncə **%** çoxalır"[1013]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "İnsanların üzərinə elə bir vaxt (zaman) gələcək ki, artıq insanı qazancının halal və ya haram yolla olması maraqlandırmayacaq"[1014].

---

[1005] Nəvəvî şərhi, Müslim "Fitən" 18/70.
[1006] Əbu Yəla, əl-Heysəmi 7/331.
[1007] Fəthul-Bəri, Buxari "Elm" 1/178, Nəvəvi şərhi, Müslim "Elm" 16/221.
[1008] Fəthul-Bəri, Buxari "Əşribə" 10/51.
[1009] İbn Məcə, əl-Albəni səhih.
[1010] İmam Əhməd, İbn Məcə, əl-Albəni səhih.
[1011] İbn Məcə, əl-Albani səhih.
[1012] Tirmizi 2212,2213, əl-Albani «Səhih Silsilə» 2203, Tahrimu alatit Tarab s. 78, İbn Əbu Dunyə «Zəmmul Məlahi», İbnu Əsakir «Tarixu Dəməşk» 12/582.
[1013] Munzirî "Tərğib və Tərhib" 9/3.
[1014] Buxari 2059, Nəsəi "Buyu" 7/243.

**29.** ***Əmanətə Xəyanətin Artması***: Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, bir nəfər Peyğəmbər – *sallallahu aleyhi və salləm* – dən soruşdu: «Qiyamət nə vaxt qopacaq?» O: «Əmanət qaldırılacağı zaman siz Qiyaməti gözləyin» deyə buyurdu. O, kişi: «Əmanət nə vaxt qaldırılacaq?» Peyğəmbər: «Layiq olmayan insana əmanət verilərsə əmanət korlanmış olar» deyə buyurdu[1015]. ***Əmanət*** – xəyanətin ziddidir. ***"Biz əmanəti*** *(Allaha itaət və ibadəti, şəri hökmləri yerinə yetirməyi)* ***göylərə, yerə və dağlara təklif etdik. Onlar ona yüklənməkdən*** *(götürüb özləri ilə daşımaqdan)* ***qorxub çəkindilər. Ona insan yükləndi. Həqiqətən, o çox zalım, çox cahildir.*** *(İnsan bu ağır əmanəti götürməklə özünə zülm etdi və cahilliyi üzündən onun çətinliyini, ağır nəticəsini bilmədi)". (əl-Əhzab 72).* Alimlər əmanəti bir çox mənalarda açıqlamışlar. 1) ***Tövhid*** – çünki o, qulun yanında qoruması lazım olan bir əmanətdir. 2) ***Əməl*** – qulun qoruması lazım olan bir əmanətdir. Əmanət dinin əmrlərini yerinə yetirmək və qadağalarından qaçmaqdır [1016]. Xuzeyfə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – bizə iki hədis rəvayət etdi. Onlardan birini gördüm, ikincisini isə gözləyirəm. Birinci - əmanətdir. İnsanların (saleh kimsələrin) qəlblərinin dərinliyinə enər. Sanki o, insanlar Quran və Sünnəni bilirlər. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – bizə əmanətin qaldırılmasından da danışdı. Bir kimsə yatar və əmanət onun qəlbindən (hafizəsindən) silinib alınar. Əmanətin əsəri, rəngi solğun bir nöqtə halında yanıq yeri kimi qalır. Sonra həmən şəxs bir də yatdığı zaman əmanətin qalan qismi də alınır. Bunun da izi əməksevər bir kimsənin ovcundakı qabarcıq (suluq) kimi yeri qalar. Belə ki, əmanət sənin ayağına saldığın bir közün düşdüyü yeri şişirdib sənin onu qabarcıq (suluq) halında gördüyün kimidir. Halbuki bu qabarcıqda (suluqda həyata təsir) bir şeylər yoxdur. Bu şəkildə insanlar bir-birilərilə alış-veriş etməkdə sabahlayarlar. (Heç kimsə əmanəti kim ödəyər deyə bir kimsə tapmaz). Belə ki: "(Gah) Filan oğulları içində əmin bir kimsə vardır (əmanəti ona verək)" deyərlər. Yenə o, kimsə üçün: "O, nə ağıllı, nə tədbirli, nə də cəsur bir kimsədir" deyərlər. Halbuki o, kimsənin qəlbində xardal dənəsi qədər iman yoxdur. Xuzeyfə: "Mən elə bir zamanda yaşadım ki, o dövürdə biri ilə alış-veriş etdikdə heç narahat olmazdım. (Alış-veriş) edəcəyim kimsə müsəlmandırsa onu İslamı (xəyanət) etməkdən çəkindirərdi. Əgər (alış-veriş) edəcəyim kimsə Xristian və Yəhudidirsə onu yaşadığı yerin vəlisi xəyanətdən çəkindirər. Bu gün isə mən filan və filankəsdən başqa heç kəslə alış-veriş edə bilmirəm"[1017].

**30.** ***Qul Qadının Öz Ağasını Doğması, Kasıbların Varlanıb Hündür Binalar Tikməkdə Bir-Birləri İlə Yarışmaları***: Peyğəmbər – *sallallahu aleyhi və salləm* – dən Qiyamətin əlamətləri haqqında soruşan Cəbrailə belə cavab vermişdir: «Qul qadın öz ağasını doğması, ayaq yalın, cılpaq, cobanların hündür bina tikməkdə bir-birləri ilə yarışmaları»[1018]. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: "Qulun xərclədiyi hər bir şeydə əcr vardır. Lakin bina bundan müstəsnadır» [1019]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: "İnsanlar binaları qat-qat yüksəltmədikcə Qiyamət qopmaz" [1020]. İbn Həcər – *rahmətullahi aleyhi* - deyir ki: "Axır zamanda cariyələr hədisdə işarə edilən tərbiyə

---

[1015] Fəthul-Bəri, Buxari "Rikâk" 11/333, Müslim.
[1016] Əhkamul Quran 3/1588,1589, Nəvəvi Şərh Müslim 2/168, İbn Kəsir 6/477, Fəthul Bəri 11/33.
[1017] "Fəthul-Bəri", Buxari "Rikâk" 11/333, "Fitən" 13/38.
[1018] Buxari, Müslim.
[1019] əl-Albani «Cəmius Səhih» 4442.
[1020] Fəthul-Bəri, Buxari "Fitən" 13/81,82.

edilənlər olacaqlar. Çünki cariyələr azad qadınlardan ayrı olaraq güclü adamların himayəsində olacaqlar. Buna görə də hədisdə: "...Ayaq yalın, cılpaq, cobanların hündür bina tikməkdə bir-birləri ilə yarışmaları" ləfzi ilə zikr edilmişdir[1021].

**31.** ***İnsanların Yalnız Tanıdıqları Kimsələrə Salam Vermələri***: İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamətin əlamətlərindən biri də insanların yalnız tanışlıq xatirinə bir-biri ilə salamlaşmalarıdır»[1022].

**32.** ***Elimsiz Kimsələrin Fətva Vermələri:*** Abdullah b. Mubarək, Əbu Umeyyə əl-Cuməhi - *radıyallahu anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Üç şey Qiyamətin əlamətlərin-dəndir. Elimsiz kimsələrdən fətva almaq..."[1023]. Abdullah b. Mubarək – *rahmətullahi aleyhi* - elimsiz kimsələrin kim olduğu barədə soruşdu. O: "Öz ağıllarına görə fətva verənlərdir" dedi. Başqa rəvayətdə: "Onlar bidət əhli olanlardır" dedilər. İbn Məsud - *radıyallahu anhu* – deyir ki, insanlar Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in səhabələrindən və böyük şəxslərdən elm aldıqları müddətdə yaxşı olurlar. Kiçiklərdən elm almağa başladıqda görüşlər ayrılır və ayrılığa düşərlər" dedi[1024].

**33.** ***Yalan Şahidliyin Çoxalması, Haqq Şahidliyin Gizlədilməsi***: İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət qopmazdan əvvəl insanlar yalan şahidlik edəcəklər və həqiqəti gizlədəcəklər»[1025]. Əbu Bəkrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizə böyük günahların ən böyüyündən xəbər verimmi? deyib bu sözü üç dəfə təkrar etdi. Səhabələr: «Bəli, ya Rəsulallah!» dedilər. Peyğəmbər: «Allaha şərik qoşmaq və ana-ataya üsyan etmək» deyə buyurdu. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – uzanmış halda durub oturdu və: «Yalan söz, yalan şahidlik! deyə bu sözləri o, qədər təkrar etdi ki, (öz-özümə) kaş ki, susaydı dedim[1026].

**34.** ***Qohumluq Əlaqələrini Kəsməyin, Qonşuluq Münasibətlərinin Pisləşməsinin Çoxalması:*** Abdullah b. Amr - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ədəbsizlik, həyasızlıq, qohumluq əlaqələrinin kəsilməsi və qonşuluq münasibətlərinin pisləşməsi çoxalmadıqca Qiyamət qopmaz»[1027]. İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Qiyamət qopmadan öncə qohumluq münasibətləri kəsilir"[1028]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Uca və Böyük olan Allah məxluqatı yaratdıqdan sonra yaratma işi tamam olduqda ***Rahim*** – qohumluq bağı ayağa qalxdı». Allah: «Dur! Söylə nə istiyirsən?» deyə buyurdu. Rahim: «Mənim bu qalxmağım qohumluq əlaqələrini kəsməkdən Sənə sığınanın qalxmasıdır». Allah: «Sənə yaxşılıq edənə yaxşılıq etməklə və səndən yaxşılığı kəsəndən yaxşılığımı kəsməyimlə razı deyilsənmi?». Rahim: «Razı oluram Ey Rabbim!» dedi. Allah: «Bu hököm sənindir». Sonra Əbu Hureyrə –

---

1021 "Fəthul-Bəri" 1/122-123.
1022 İmam Əhməd "Müsnəd" 5/326, Ahməd Şakir "Səhih".
1023 "Zühd" s: 20-21. H. 61, "Fəthul-Bəri" 1/143, əl-Albâni "Camius-Sağir" 2/243, H. 2203.
1024 "Zühd" s: 281, H. 815, Təbərâni "Kəbir" və "Əvsat", AbdurRazzaq "Musannəf" 11/347, H. 20446.
1025 İmam Əhməd "Musnəd" 5/333, "İbn Kəsir "Təfsiri" 6/140, "Fəthul-Bəri" 5/262.
1026 Buxari 2654, Müslim 87.
1027 İmam Əhməd "Musnəd" 10/26-31, Əhmed Şakir "Səhih", Hakim "Mustədrək 1/75-76.
1028 Musnəd 5/333, Əhməd Şakir "Səhih".

*radıyallahu anhu* – dedi ki, istəsəniz bu ayəni oxuya bilərsiniz: ***«Əgər** (Peyğəmbərdən)* ***üz döndərsəniz sizdən yer üzündə fitnə-fəsad törətmək və qohumluq tellərini qırmaq gözlənilməzmi»*** *(Məhəmməd 22)»*[1029]. Əbu Şureh – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allaha and olsun ki, iman gətirməz! Allaha and olsun ki, iman gətirməz! Allaha and olsun ki, iman gətirməz!». Səhabələr: «Kim Ey Allahın Rəsulu!» deyə soruşdular. Peyğəmbər: «Qonşusu şərindən əmin olmayan kimsə»[1030]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qonşusu şərindən əmin olmayan kimsə Cənnətə girməz»[1031].

**35.** ***Yaşlıların Gənclərə Bənzəməsi:*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Axır zamanlarda saç və saqqalını göyərçin sinəsi kimi qara rəngə boyayan insanlar olacaqdır. Onlar Cənnətin qoxusunu da belə duymayacaqlar»[1032]. İbnul Covzi – *rahmətullahi aleyhi* - deyir ki: "Bu hədisdə "***Cənnətin qoxusunu almazlar***" sözünün mənası boyama səbəbinə görə deyildir, onlarda olan pis bir əməl və etiqada görədir. Eynilə Xəvariclərin özəlliklərindən saçlarını keçəl qırxmalarıdır. Belə ki, saçı keçəl qırxmaq haram deyildir"[1033]. İbnul Covzi – *rahmətullahi aleyhi* - deyir ki: "Səhabə və tabiindən bir çox kimsə saç və saqqalarını boyamışlar. Həsən, Hüseyn, Sad b. Əbu Vaqqas – *Allah onlardan razı olsun* - onlardandır. Tabiinlərdən də bir çoxları saçlarını keçəl qırxmışlar". Buna görə də Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – saç və saqqalını qara rəngə boyamağı qadağan etmişdir. Əbu Kuhafə saç-saqqalı ağarmış halda Məkkənin fəthi günü Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gətrilir. Peyğəmbər: «(Saç-saqqalını qəsd edərək) bunu bir şeylə dəyişdirin və (bu işdə) qara rəngdən çəkinin»[1034].

**36.** ***Vaxtın Sürətlə Getməsi***: Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Zaman qısalmadıqca Qiyamət qopmaz"[1035]. Əbu Hureyrə, Ənəs - *radıyallahu anhm* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Vaxt sürətlə getməyənə qədər Qiyamət qopmaz. İl aya, ay həftəyə, həftə günə, gün saata, saat da xurma yarpağının yanıb kül olması qədər olacaqdır»[1036]. Zamanın qısalmasıyla bağlı alimlərin dəyişik görüşləri vardır: 1. Bundan qəsd zamandakı bərəkətin az olmasıdır. 2. Bundan qəsd Mehdi və İsa - *əleyhissəllam* - ın zamanında olacaq həyatın insanlara xoş gəlməsi, əminliyin və ədalətin artmasıdır. Buna görə də uzun olsa da belə xoş günlərin insanlara qısa gəlməsi, qısa da olsa acı günlərin onlara uzun gəlməsidir. 3. Bunda qəsd o, zamanda uzaqda yaşayan insanların sürətli vasitələrlə tez bir zamanda istədikləri yerə getmələridir. 4. Dəccəl çıxdığı vaxt günlərin uzun olduğu kimi, qısa da olacaq[1037].

---

1029 Buxari «Ədəbul Mufrad» 50.
1030 Fəthul Bəri 10/443.
1031 Buxari «Ədəbul Mufrad» 121.
1032 Əbu Davud 4/319, əl-Albani «Səhihul Cəmi» 8153.
1033 "Movzuat" 3/55.
1034 Müslim 3/1663.
1035 Fəthul-Bəri, Buxari "Fitən" 13/81,82.
1036 İmam Əhməd "Musnəd" 2/537-538, Tirmizi, əl-Albani "Camius-Sağir" 6/175, H. 7299.
1037 Məalimus-Sünnə" 6/141-142, "Camiul-Usûl" 10/409. "Fəthul-Bəri" 13/16, "Muhtasar Sünən Əbu Davud", Munzirî 6-142, "İslam Etiqadı" Seyyid Sabıq s:247.

**37.** ***İnsanların Bir-Birinə Olan İnamının İtməsi***: Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnamın itdiyi zaman Qiyaməti gözləyin»[1038].

**38.** ***Alış-Veriş Yerlərinin Bir-Birinə Yaxın Olması:*** Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Fitnələr çıxmadıqca, yalan çoxalmadıqca və alış-veriş mərkəzləri bir-birinə yaxın olmadıqca Qiyamət qopmaz"[1039].

**39.** ***Məscidlərin Və Quranın Bəzədilməsi***: Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnsanlar bir-birlərinin qarşısında məscidlərlə öyünmədikcə Qiyamət qopmaz»[1040]. Ənəs - *radıyallahu anhu* – deyir ki, insanlar məscidlərlə öyünəcək və onları az-az ziyarət edəcəklər. Onlar məscidləri bəzəməklə öyünəcəklər». İbn Abbas - *radıyallahu anhu* – deyir ki: "Siz məscidləri Yəhudilərin və Xaçpərəstlərin etdikləri kimi bəzəyəcəksiniz»[1041]. Əbu Dərdə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Əgər siz məscidləri və Quran vərəqlərini bəzəməyə başlasanız onda siz məhv olacaqsınız»[1042]. Ömər - *radıyallahu anhu* – məscidi inşa edərkən deyir: "Sən sadəcə insanları yağışdan qoru. Nə badə (məscidləri) al-sarı rəngə boyamaqla bəzəyib insanları fitnəyə salma"[1043]. Məscidləri yaşatmaq onları bəzəməklə deyildir. Məscidləri yaşatmaq orada namaz qılmaq və Allahı zikr etməklə olur. Məscidlər insanları yağışdan, istidən və soyuqdan qorumaq üçün tikilib. Şafiilər deyirlər ki: "Kəbə daxil olmaqla məscidləri qızıl və gümüşlə bəzəmək haram, digər bəzəklərlə bəzəmək isə məkruhdur"[1044].

**40.** ***Axşam Görsənən Hilalın Uzun Müddət Qalması:*** İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Axşam görsənən Təzə ayın göydə qalma müddətinin uzanması Qiyamətin əlamətlərindəndir"[1045]. Əbu Hureyrə, Ənəs - *radıyallahu anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Təzə ayın göydə qalma müddətinin uzanması Qiyamət əlamətlərindəndir. Hilal ay bir gecə görsənəndə: "İki gecə görsəndi" deyilər.[1046]

**41.** ***Yuxuların Çin Çıxması:*** Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Vaxtın sürətlə getməsindən müsəlmanların yuxuları demək olar ki, onları aldatmayacaqdır. Xeyirli yuxular görən kimsə ən xeyirli insan sayılacaq. Müsəlmanın yuxuları Peyğəmbərliyin qırx beşdə biridir (Başqa rəvayətdə: Qırx altıda biridir, yetimşdə biridir)»[1047]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Xeyirli yuxu Allahdan, şərr yuxu isə şeytandandır. Biriniz xoşlamadığı çirkin bir yuxu görərsə həmən sol tərəfinə üç dəfə tüfürsün. Sonra da o, yuxunun şərrindən Allaha sığınsın (Başqa rəvayətdə: Hansı tərəfdə yatmışsa digər tərəfə dönsün). Belə edərsə o, pis yuxu artıq ona heç bir zərər

---

[1038] Buxari.
[1039] Musnəd 2/519, Heysəmi "Məcmauz-Zəvaid" 7/327.
[1040] İmam Əhməd "Müsnəd" 3/134, əl-Albani səhih "Sahihul-Cami" 6/174, H. 7298.
[1041] Buxari.
[1042] Həkim, Tirmizi, əl-Albani «Səhih Hədislər Silsiləsi» 3/337, H. 1351, Camius-Sağir" 1/220, H. 599.
[1043] Fəthul-Bəri, Buxari "Salât" 1/539.
[1044] "Feyzul-Qadîr' 1/367.
[1045] Təbərâni "Kəbir", Heysəmi "Məcmauz-Zəvâid" 3/146, əl-Albâni "Camius-Sağir" 5/213-214, H. 5774.
[1046] Təbəranî "Sağir", Heysəmi "Məcmauz-Zəvâid" 3/146, 7/325, əl-Albâni "Camius-Sağir" 5/214, H. 5775.
[1047] Buxari, Müslim.

verə bilməz. Və bu yuxunu heç kəsə xəbər verməsin. Əgər gözəl bir yuxu görərsə həmən sevinsin və o, gözəl yuxunu sevdiyi kimsələrdən başqasına xəbər verməsin»[1048]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: Yuxu üç cürdür: «Saleh bir yuxu Allahdan bir müjdədir, şeytandan olan bir yuxu bu hüzündür və bir də insanın bir şey haqda çox düşünməsindən görülən yuxu»[1049]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mubəşşiratdan başqa nübuvətdən bir şey qalmadı». Oradakılar: «Mubəşşirat nədir?» deyə soruşdular. Peyğəmbər: «Saleh yuxudur» deyə buyurdu[1050]. Bir nəfər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gələrək dedi: «Mən yuxuda başımın kəsilmiş olduğunu və başımın ardıyca getdiyimi gördüm». Peyğəmbər: «Yuxuda şeytanın səninlə oynamasını insanlara xəbər vermə» deyə buyurdu[1051]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: Məni röyasında görən məni görmüş kimidir. Çünki şeytan mənim surətimə girməz»[1052]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Röyasında məni görən ayıq ikən də məni görəcəkdir. Şübhəsiz ki, şeytan mənim surətimə girməz»[1053]. Sələflər deyirlər ki: "Bu hadisələrin son andan baş verməsinin səbəbi o, vaxtı mömin kimsənin qərib olmasıdır". Yenə də: "O, vaxtı mömin kimsənin dostu və yardımçısı az olduğundan ona gördüyü yuxunun həqiqət olmasıyla ehtiram edilir"[1054].

**42.** ***Huzeyfə b. Yəmən - Radıyallahu Anhu – Nun Fitnələr Haqqınada Xəbər Verməsi***: Huzeyfə b. Yəmən - *radıyallahu anhu* – deyir ki, insanlar Allah Rəsulundan xeyir haqqında soruşardılar. Mən isə başıma gəlir qorxusu ilə şərr haqqında soruşurdum. Bir dəfə: «Ey Allahın Rəsulu! Biz cəhalət və küfrün içində idik. Allah bizə xeyir nəsib etdi. Bu xeyirdən sonra şərr olacaqmı?» dedim. Peyğəmbər: «Bəli» deyə cavab verdi. Mən: «Bu şərrdən sonra yenə xeyir varmı?» deyə soruşdum. O: «Bəli, lakin bu xeyirdə ***Dəhan*** vardır» dedi. Dəhan nədir? Ya Rəsulullah! – deyə soruşulduqda o: «Elə bir topluluq gələcək ki, mənim sünnəmdən başqa bir sünnəyə əl atacaqlar. Sənin pis gördüyün bəzi işləri onlar yaxşı görəcəklər» dedi. (Başqa rəvayətdə: «Onların qəlbləri insan surətindəki şeytanların qəlbləri kimidir» dedi. Mən: «Ya Rəsulullah! Onlara yetişsəm nə edim?» dedim. O: «Belinə-belinə vursalar da belə əmirin sözünü dinlə və ona itaət et!»). Mən: «Bu xeyirdən sonra şərr olacaqmı?» deyə soruşdum. O: «Bəli, Cəhənnəmin qapılarında duraraq insanları ora dəvət edən insanlar olacaqdır. Kim onlara itaət edərsə onu Cəhənnəmə atarlar» dedi. Mən: «Ya Rəsulullah! Onları bizə vəsf et?» dedim. O: «Onlar bizdəndirlər və bizim dilimizdə danışırlar» dedi. Mən: «Bu söylədiyin şeylər məni taparsa onda nə edim?» deyə soruşdum. O: «Müsəlmanların cəmaatına sarıl və imamlarına uy!» dedi. Mən: «Əgər nə cəmaat, nə də imamları olmasa necə!» dedim. O: «Onda ağacın kökündən sarılaraq ölüm sənə gələnə qədər bu firqələrin hər birindən uzaqlaşıb hamısını tərk et (Başqa rəvayətdə: Bundan sonra Dəccəl çıxacaqdır)»[1055]. Xuzeyfə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Nəfsim əlində olan Zul Cələlə and olsun ki! İmamınızı öldürmədikcə, qılınclarınız bir-birilə toqquşmadıqca,

---

[1048] Müslim 2261.
[1049] Müslim 2263.
[1050] Buxari.
[1051] Müslim 2269.
[1052] Buxari.
[1053] Buxari, Müslim.
[1054] "Fəthul-Bəri" 12/406.
[1055] Buxari 3606, Müslim, Əhməd, Əbu Davud.

dünyanıza şərlilər varis olmadıqca Qiyamət qopmaz”[1056]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İki böyük İslam ordusu bir-biri ilə savaşmadıqca Qiyamət qopmaz. Bu iki toplumun ikisi də eyni iddiada olduqları (ikisi də İslamiyyət və haqq iddiasında olduqları) halda aralarında böyük savaş olacaqdır. «Şübhəsiz ki, mənim ümmətimdən otuza yaxın yalançı çıxacaq. Onların hər birisi bir Peyğəmbər olduğunu iddia edəcəkdir. Elm yox olmadıqca, zəlzələlər çoxalmadıqca, fitnələr ortaya çıxmadıqca, adam öldürmə halları çoxalmadıqca, aranızda mal çoxalıb sel kimi axmadıqca qiyamət qopmayacaqdır. Mal o, qədər çoxalacaq ki, mal sahibi malının zəkatını kim qəbul edər deyə səsləyəcəkdir. Belə ki, bəzi kimsələrə zəkat vermək istəyəcəkdir o, da mənim zəkata ehtiyacım yoxdur! deyəcəkdir. Yenə insanlar hündür binalar tikməkdə bir-birləri ilə yarışacaqlar, bir kimsə başqasının məzarının yanından keçərkən: «Kaş ki, onun yerində mən olardım!» deyərək (ölümü istəmədikcə) qiyamət qopmayacaqdır. Günəş batdığı yerdən doğmadıqca yenə də qiyamət qopmayacaqdır. İnsanlar bu halı gördükdə iman gətirəcəklər. Lakin bu iman daha əvvəl iman etməmiş olan və ya imanlarında heç bir xeyir qazanmamış kimsələrin imanlarının onlara heç bir faydası olmayacaqdır. Heç şübhəsiz ki, Qiyamət qopacaqdır. Alan ilə satan arasında alış-veriş tamamlanmadan Qiyamət qopacaqdır. Heç şübhəsiz ki, Qiyamət qopacaqdır. Dəvəsinin südünü sağıb gələn kimsəyə südü içmək imkanı olmadan Qiyamət qopacaqdır. Yenə heç şübhəsiz ki, Qiyamət qopacaqdır. Yemək yeməyə oturan bir kimsənin loxmanı ağzına qoymaq fürsəti qalmadan Qiyamət qopacaqdır»[1057].

**43.** ***İslam Torpaqlarının Genişlənməsi: «De – Allah başınızın üstündən və ayaqlarınızın altından*** *(göydən və yerdən)* ***sizə əzab göndərməyə, sizi dəstələr halında qarışdırmağa və birinizə digərinizin zorunu daddırmağa qadirdir! Gör ayələrimizi onlara nə cür izah edirik ki, bəlkə başa düşsünlər!».*** *(əl-Ənam 65).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah yer üzünü mənə görə cəm etdi və (mənə göstərdi). Onun şərqini də, qərbini də gördüm. Mənim ümmətimin səltənəti mənim üçün ayrılmış torpağın sahəsinə qatılacaqdır. Mənə iki xəzinə qırmızı – Sezarın qızılı, və ağ – Xosrovun daş-qaşı verildi. (Hər ikisi də Ömər - *radıyallahu anhu* – nun dövründə alınıb və Allah yolunda da paylanılmışdır). Allahımdan ümmətimi kütləvi qıtlıqla həlak etməməsini, canlarına və mallarına qəsd edən özlərindən olmayan bir düşmənin ümmətim üzərində hökmüranlıq etməməsini xahiş etdim. Allah: «Ey Muhəmməd! Mən bir işə hökm verirəmsə, şübhəsiz ki, o geriyə dönməz və Mən sənin ümmətinin bir hissəsi başqa bir hissəsini həlak edənədək və bir hissəsi başqa bir hissəsini əsir alanadək onları ümumi bir qıtlıqla həlak etməməyimi, özlərindən olmayan bir düşmənin onların malları və canları üzərində hökmüranlıq etməməsi istəyini yerinə yetirdim. Lap istəyirsə yer üzünün hər tərəfindən olan insanlar yığışıb onlara qarşı gəlsinlər və yaxud onun hər tərəfindən kim istəyirsə bir yerdə toplaşıb gəlsinlər. (Başqa rəvayətdə: «Rəbbimdən üç şey istədim. Mənə ikisini verdi, amma üçüncüsünü vermədi. Rəbbimdən ümmətimi kütləvi aclıqdan həlak etməməsini dilədim, bu istəyimi verdi. Yenə Ondan ümmətimi suda boğularaq həlak edilməməsini istədim, onu da mənə verdi. Yenə də Ondan ümmətimin bir hissəsini digər bir hissəsinə qırdırmamasını istədim, onu mənə vermədi)»[1058]. Cabir - *radıyallahu anhu* – rəvayət

---

[1056] Tirmizi “Fitən” 9, 2171.
[1057] Buxari “Fitən” 24, “Mənakib” 25, Müslim “İman” 248, (157).
[1058] Müslim.

edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – belə buyurduğunu eşitdim: «İnsanlar Allahın dininə bölük-bölük girdilər və bölük-bölük də dindən çıxacaqlar»[1059].

**44. *Ümmətdə Şirkin Zühur Etməsi:*** Qiyamətin əlamətlərindəndir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in ümmətində şirk zühr edəcəkdir. Artıq İslam gəldikdən sonra, peyğəmbərlik verildikdən sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ümətini Tövhidə dəvət etdi. Ümməti İslamı qəbul edərək şirkdən çəkindilər. Artıq Məkkənin fəthindən sonra Məkkədə müşrik qalmadı. Ərəbistan yarmadası bütünlüklə İslamı qəbul etdilər. Quran bunu qadağan etdiyi halda. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bunun üçün göndərildiyi halda çox keçmədi ki, insanlar yenidən bu çirkin əməli işləyərək Allaha şəriklər qoşmağa başladılar. Sovban - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mən ümmətim üçün haqq yoldan azdıran imamlardan qoxuram. Ümmətimin arasına qılınc davası düşdüsə bu Qiyamət gününədək davam edəcəkdir. Ümmətimin bəzi tayfaları müşriklərə qoşulmadıqca və bəzi tayfaları bütlərə sitayiş etmədikcə Qiyamət qopmayacaqdır»[1060]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «***Devs*** qəbiləsinin qoca qadınları ***Zul Xalasa*** (bütü) ətrafında tavaf edə-edə quyruqlarını titrətmədikcə qiyamət qopmayacaqdır. ***Zul Xulasa Devs*** qəbiləsinin cahiliyyə dövründə ibadət etdikləri bütdür»[1061]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – hədisində xəbər verdiyi həqiqətdir. Cahillik və elimsizlik yayıldıqda **Devs** və onun ətrafında olan qəbilələr təkrar cahiliyyə dövrünə qayıdaraq ***Zul Xalasa*** ibadət etnməyə başladılar və bu hal Muhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* – nin Hicazda Tövhidə dəvət edərək insanlara dinlərini başa salmağa qədər davam etdi. Ondan sonra AbdulAziz b. Muhamməd b. Suud, ***Zul Xalası*** yıxmaq üçün bir qrup adam göndərdi və onlar da bunu etdilər. Lakin Hicazda Suud ailəsinin hökmüranlığı bir ara kəsildikdə təkrar insanlar ***Zul Xalasa*** ibadət etməyə başladılar. Kral AbdulAziz b. AbdurRahman idarəçiliyə keçəndən sonra ***Zul Xalası*** yıxmaq üçün qrup göndərdi. Allahın izni ilə bu bütü tamamilə yox etdilər[1062]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Gecə və gündüz ***Lat*** və ***Uzzaya*** ibadət edilmədikcə yox olub getməz»[1063].

**45. *Xəsislik (Simicliyin) Artması:*** Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamətin əlamətlərində biri də Xəsislikyin (simiclik) artmasıdır"[1064]. Əli - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Zamanın qısalması, işin azalması, simicliyin artması Qiyamət əlamətlərindəndir"[1065]. Muaviyə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İşlər çətinləşmədikcə, insanlar simicləşmədikcə Qiyamət qopmaz"[1066]. Cabir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «…Tamahkarlıqdan çəkinin! Çünki o, sizdən əvvəlkiləri məhv etmiş və onları

---

1059 İmam Əhməd 3/343.
1060 Müslim 4/2215, Əbu Davud 4202,4252, İbn Məcə 3952, Əhməd 5/278,284, "Avnul-Mabud", "Sünən Əbu Davud" 11/322,324, Tirmizi 6/466, əl-Albani "Camius-Sağir" 6/174, H. 7295.
1061 Buxari 13/76, Müslim 4/2230,2906.
1062 "İthaful-Cəmâa" 1/522-533.
1063 Müslim 4/2230,2907.
1064 Təbərânî "Evsat", "Fəthul-Bəri" 13/15, Heysəmi "Məcmauz Zəvâid" 7/328.
1065 Fəthul-Bəri, Buhari "Fitən" 13/13.
1066 Təbərâni, "Məcmauz-Zəvâid" 8/14.

(birbirilərinin) qanlarını axıtmağa, özlərinə haram buyurulan şeyləri halal qəbul etməyə vadar etmişdir (Başqa rəvayətdə: Qohumluq əlaqələrini kəsməyə vadar etmişdir)»[1067].

**46. *Ticarətin Böyüməsi:*** İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sadəcə tanıdıqları kimsələrə salam vermək və ticarətin yayılması Qiyamət əlamətlərindəndir. Belə ki, qadın ərinə ticarətdə yardımçı olacaqdır"[1068]. Amr b. Tağləb - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Malın və pulun çoxalması, ticarətin çoxalması Qiyamət əlamətlərindəndir"[1069]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizi sevindirəcək şeylərin müjdəsini sizə verirəm və bunları (gələcəkdə də) ümüd edə bilərsiniz. Allaha and olsun ki, mən sizin üçün fəqirlikdən qorxmuram. Lakin mən sizin üçün əvvəlkilərə dünyanın imkanları geniş verildiyi kimi sizə də veriləcəyindən və onlar necə bu şeydə bir-birləri ilə yarışdıqları kimi sizin də yarışacağınızı və (dünya) onları necə həlak etdisə sizi də həlak edəcəyindən qorxuram»[1070].

**47. *Mala Hərisliyin Artması:*** Auf b. Məlik, İbn Ömər - *radıyallahu anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günündən qabaq altı hadisəni gözləyin: «Üzərinizə bol miqdarda mal (və pul) yağacaqdır (zəngin olacaqsınız). Belə ki, adama on min dinar veriləcəkdir. Lakin yenə də bu azmış kimi qızacaqdır»[1071].

**48. *Mədinənin Boşalması:*** Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «...Mədinə pası aparan körükçü kimidir. Mədinə içində olan pisləri eynilə körügün dəmirin pasını çıxardığı kimi çıxarmadıqca Qiyamət qopmaz"[1072]. Cabir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gələrək İslama girdi. Səhəri qızdırma (isitmə) ilə gəldi və: "Ya Rəsulullah! Mənim geri dönməyim üçün izin ver" dedi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu təklifi üç dəfə qəbul etmədi və sonra: "Mədinə dəmirçi körügü kimidir, təmizi buraxır, pisi isə çölə atar" deyə buyurdu[1073]. Qadi İyad – *rahmətullahi aleyhi* - deyir ki: "Bu hadisə artıq Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in vaxtında baş vermişdir". İmam Nəvəvi – *rahmətullahi aleyhi* - deyir ki: "Dəccəlin zamanında da baş verəcəkdir"[1074]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «...Mədinə və əhalisi üç dəfə sirkələnəcəkdir. Mədinədə bir nəfər belə münafiq kişi və qadın qalmaz. Hamısı onun (Dəccəlin) yanına gedirlər[1075])». Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Siz Mədinəni xeyirli halıyla tərk edəcəksiniz və orada vəhşi heyvan və quşlardan başqa heç kimsə olmayacaqdır. Mədinəyə ən son gələn qoyunlarını bağıraraq otlatan ***Muzeynə*** qəbiləsindən olan iki çobandır. Bunlarda Mədinəni bomboş buraxıb gedəcəklər və ***Səniyətul Vəda*** adlanan yerə çatdıqda üzü üstə düşəcəklər"[1076]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və*

---

[1067] Buxari «Ədəbul Mufrad» 487,488.
[1068] "Musnəd" 5/333, "Mustədrək" 4/445-446, Əhməd Şakir "Səhih".
[1069] Nəsəi 7/244, "Musnəd" 5/69, əl-Albâni "Səhih Hədislər" 2/251-252.
[1070] Buxari 4/63, Müslim şərhi 5/816.
[1071] Buxari, Əhməd, İbn Məcə.
[1072] Nəvəvi Şərhi, Müslim "Həcc" 9/153.
[1073] Fəthul-Bəri, Buxarî "Fədaili Mədinə" 4/96.
[1074] Nəvəvî Şərhi, Müslim 9/153.
[1075] Fəthul-Bəri, Buxarî "Fədaili Mədinə" 4/95, İbn Məcə «Fitən» 33.
[1076] Fəthul-Bəri, Buxarî "Fədaili Mədinə" 5/89,90.

*səlləm* – buyurdu: «Siz Mədinəni gözəl halıyla tərk edib gedəcəksiniz. Belə ki, köpək və ya canavar ora gələcək və məscidin divarına (minbərinə) bövl edəcəkdir. Səhabə: "Ya Rəsulullah! O, gün kim qazanır?" dedi. Peyğəmbər: "Yırtıcı quşlar və heyvanlar" deyə buyurdu[1077]. Cabir - *radıyallahu anhu* – deyir ki, Ömər - *radıyallahu anhu* – mənə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən eşitdiyini xəbər verdi: "Mədinənin kənarında dolaşan birisi deyər: Vaxtıkən burada bir çox müsəlmanlar otururdular"[1078].

**49. *Rumlularla Döyüş*:** Auf b. Məlik, İbn Ömər - *radıyallahu anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günündən qabaq altı hadisəni gözləyin: «Sonra sizinlə Rumlular arasında bir sülh bağlanacaqdır. Sonra onlar bu sülh müqaviləsini pozub hər birinin altında on iki min əskər olan səksən bayrağ altında üzərinizə gəlirlər. Çox şiddətli bir döyüş olacaqdır. Bu döyüşdə müsəlmanlar qalib gələcəklər. Başları qənimətə qarışdıqda kömək istəyən biri gəlib deyəcəkdir: «Dəccal arxanızda arvad-uşaqlarınıza hücum edib». Bunu eşidər-eşitməz əllərindəki qəniməti buraxaraq Dəccalın olduğu tərəfə gedərlər. Peyğəmbər: «Mən onların və atalarının adlarını, atlarının rəngini də bilirəm. Onlar o, gün yer üzünün ən xeyirli süvarilərdirlər»[1079]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Rumlular Amak və Dabikə (Hələb şəhərinə yaxın iki yerdir) enmədən Qiyamət qopmayacaqdır. O, gün yer üzünün ən xeyirlilərindən Mədinəli əskərlər onlara qarşı çıxacaqlar. O, zaman iki tərəfində səfləri qarşı-qarşıya gəldikdə Rumlular: «Bizi və bizdən əsir olanları baş-başa buraxın ki, onlarla savaşaq» deyərlər. Müsəlmanlar: «Vallahi! Qardaşlarımızı sizin əlinizə verməriк» deyərlər. Rumlularla savaşırlar. Müsəlmanların üçdə biri döyüşdən qaçar. Allah onların tövbələrini əsla qəbul etməz. Müsəlmanların üçdə biri şəhid olar. Onlar Allah qatında şəhidlərin ən üstünüdürlər. Geri qalan üçdə biri isə müzəffər olub Konstantinopolu fəth edərlər. Onlar qəniməti paylaşdırdıqları və qılınclarını zeytun ağacından asdıqları vaxt şeytan onlara yüksək səslə: «Məsih Dəccəl arxadan ailənizə girmişdir» deyər. Onlar da geri dönərlər. Lakin bu xəbər yalan olacaq. Şama gəldikdə isə Dəccəl çıxar. Müsəlmanlar savaşa hazılaşıb səflərini düzəldərək namaza dururlar və imamları onlara qıldıracaqdır. Allahın düşməni (Dəccəl), Məryəm oğlu İsa – *əleyhissəlam* – gördükdə duz suda əridiyi kimi əriyər. İsa – *əleyhissəlam* – onu buraxsa yox oluncaya qədər əriyib gedərdi. Amma Allah İsa – *əleyhissəlam* – əli ilə onu öldürür. Onun qanını Peyğəmbərin nizəsində onlara göstərir»[1080]. Cabir b. Səmura, Nəfi b. Utbə belə dediyini söyləyir: "Biz Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə birlikdə idik... Orada Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən dörd kəlimə əzbərlədim və onları daima hifzimdə (əlimdə) saxlayıram. O: "Siz Ərəb yarımadasını fəth etmək üçün döyüş edəvcəksiniz. Allah oranı sizə verir. Sonra İranı fəth etmək üçün döyüşəcəksiniz. Allah oranı sizlərə verir. Sonra Rumlularla döyüşəcəksiniz. Allah oarnı da sizlərə verir. Sonra Dəccəl ilə döyüşəcəksiniz. Allah sizi qalib edəcəkdir. Nafi: "Ya Cabir! Rum diyarı fəth olunana qədər Dəccəlin çıxmayacağını zənn edirəm" dedim[1081]. Əbu Darda - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamətdən öncə olan böyük döyüşdə müsəlmanlar Qota

---

[1077] "Muvatta" 2/888, "Fəthul-Bəri" 4/90.
[1078] "Musnəd" 1/124, H. 124, Əhməd Şakir "Səhih".
[1079] Buxari «Cizyə» 15, Müslim «Fitən» 37, İbn Məcə «Fitən» 25, Əhməd 6/25.
[1080] Müslim «Fitən» 34, 2897, İbn Əbi Şeybə 15/157-158, Həkim 4/482.
[1081] Nəvəvi Şərhi, Müslim "Fitən" 18/26.

bölgəsində Şam şəhərində toplanırlar. O, Suriyənin ən yaxşı şəhəridir"[1082]. İbn Məsud - *radıyallahu anhu* – dayanmışdı. Bu sözləri söylədiyi zaman oturdu və: "Miras paylaşmadıqca və qənimətlər sevilmədikcə Qiyamət qopmaz. Sonra əlini Şam tərəfə işarə edərək: Üçox böyük bir düşmən müsəlmanlarla döyüşmək üçün ordu və silah toplayarlar, müsəlmanlar da onlarla döyüşmək üçün ordu və silah toplayarlar" dedi. Ravi: "Rumluları qəsd edirsən?" dedim. İbn Məsud: "Bəli" dedi. Bu döyüş zamanı böyük qarşıdurma olacaqdır. Belə ki, müsəlmanlar ölüm-qalım döyüşü edəcəklər, lakin qalib olaraq dönən bir fədailər dəstəsi gecə olana qədər düşmənlə döyüşürlər. Nəticədə düşmən ordusu da, İslam ordusu da geri dönərlər. İki ordudan heç biri qalib deyildir. Halbuki hər iki tərəfində döyüşən fədailəri yox olub getmişdilər. Sonra müsəlmanlar yenə də ölüm-qalış döyüşünə qatılacaqlar, lakin qalib olaraq geri dönə biləcək fədailər dəstəsi çıxarılacaq. Ordular axşam olana qədər döyüşəcəklər. Axşam olduqda isədüşmən ordusu da, İslam ordusu da geri çəkilirlər. Fədailər dəstəsi yox olduğu halda onlardan heç biri qalib deyildir. Sonra müsəlmanlar yenə də ölüm-qalış döyüşünə qatılacaqlar, lakin qalib olaraq geri dönə biləcək fədailər dəstəsi çıxarılacaq. Ordular axşam olana qədər döyüşəcəklər. Axşam olduqda isə düşmən ordusu da, İslam ordusu da geri çəkilirlər. Fədailər dəstəsi yox olduğu halda onlardan heç biri qalib deyildir. Artıq dördüncü gün olduğu zaman müsəlmanların hamısı onların üzərinə hücum edərlər. Bu zaman Allah düşməni məğlubiyyətə uğradır. Elə böyük bir döyüş olur ki, belə bir döyüş olmamışdır və ya olmaz deyilir. Hətta bir quş o, döyüşən ordunun yanından ötdüyü zaman ölü olaraq yerə düşər. Belə ki, bir ata **100** oğlunu bu döyüşə yollasa da sonda onlardan yalnız birinin sağ qaldığını görər. Artıq miras paylanılır, qənimətlər sevilir. Onlar bu halda ikən bir çağırışçı onların yanına gələrək: Dəccəl onların ailələri və torpaqlarını ələ keçirmişdir deyər. Bu vaxt İslam ordusu hər bir şeyi olduğu kimi tərk edərək öz torpaqlarına dönərlər. On suvari dəstə ordunun önündə yola çıxır. Peyğəmbər: "Mən bu suvarilərin adlarını, atalarının adlarını və atlarının rənglərini də bilirəm. Onlar o, zamanda yer üzündə olan süvarilərin ən xeyirliləridirlər"[1083].

**50. *Konstantinopolun Fəthi*:** Auf b. Məlik, İbn Ömər - *radıyallahu anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günündən qabaq altı hadisəni gözləyin: «Ya Rəsulullah! ***Konstantinopol*** (***İstanbul***)[1084] ilk öncə fəth ediləcəkdir yoxsa Rumiyyə?» deyə soruşdum. O: «***Konstantinopol***» deyə buyurdu[1085]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir tərəfi quruda, bir tərəfi isə dənizdə olan şəhəri bilirsinizmi?». Səhabələr: «Bəli, ya Rəsulullah!». O: «Bəni İshaqdan yetmiş min kişi ora savaşa getmədikcə qiyamət qopmaz. Ora çatdıqda qərərgah qurarlar. Amma silahla savaşmaz və bir ox da belə atmazlar. Yalnız – ***Lə İləhə İlləllahu Vallahu Əkbər*** – dediklərində şəhərin bir tərəfi, ikinci dəfə - ***Lə İləhə İlləllahu Vallahu Əkbər*** – dedikdə şəhərin digər tərəfi, üçüncü dəfə - ***Lə İləhə İlləllahu Vallahu Əkbər*** – dedikdə şəhər qapıları onların üzünə açılar. Onlar qəniməti paylaşdırarkən imdat səsi

---

[1082] Ebu Davud "Məlâhim" 11/406, "Avnul-Məbud", "Camius-Sağir" 2/218, H. 2112.

[1083] Nəvəvi Şərhi, Müslim "Fitən" 18/24-25.

[1084] Muaviyə - *radıyallahu anhu* – oğlu Yəzidin başçılığı ilə Konstantinopolun fəthi üçün bir ordu göndərir. Əbu Əyyu əl-Ənsari - *radıyallahu anhu* – bu orduların birində başçı idi. Lakin fəth onlara müyəssər olmur. Bundan sonra Məsləmə b. Abdulməlik b. Mərvan da oraya bir ordu göndərir. Lakin onlara da fəth müyəssər olmur. Məscid tikmək şərtilə Bizanslılarla barış imzalayırlar.

[1085] Buxari «Cizyə» 15, İbn Məcə «Fitən» 25, Əhməd 6/25.

onlara gələrək: «Dəccəl gəlmişdir!» deyər. Onlar da hər şeyi buraxıb geri dönərlər[1086]. İbn Kəsir – *rahmətullahi aleyhi* - deyir ki: "Bu hədis axır zamanda Rumluların müsəlman olacaqlarını göstərir. Bəlkə də İstanbul onlardan bir qrup tərəfindən fəth olunacaq. Hədisdə deyildiyi kimi: "Bəni İshaqdan **70** min nəfər". Müştəvrid, Amr b. As - *radıyallahu anhu* – nun yanında rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Qiyamət Rumlular insanların ən çoxu olduqları zaman qopar". Amr: "Nə söylədiyinə fikir ver" dedi. O: "Mən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən eşitdiyimi söyləyirəm" dedi. Amr: "Onlarda dörd xislət vardır: "Onlar fitnələr zamanı insanların ən ağıllı və təmkinlilərdir. Müsibətdən sonra ən sürətli həyata və xeyirə dönənlərdir. Qaçdıqdan sonra təkrar hücuma keçmələri tez olur, yetim və zəiflər üçün insanların ən xeyirliləridirlər. Beşinci də çox gözəl bir sifətdir: Kralların zülmünə ən çox mane olanlardır" [1087] . Rumluların çoxalması və müsəlmanlarla döyüşmələri bölümündə keçən hədis də bunu dəstəkliyir: O, zaman iki tərəfində səfləri qarşı-qarşıya gəldikdə Rumlular: «Bizi və bizdən əsir olanları baş-başa buraxın ki, onlarla savaşaq» deyərlər. Müsəlmanlar: «Vallahi! Qardaşlarımızı sizin əlinizə vermərik» deyərlər[1088]. Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «***İstanbulun*** fəthi Qiyamətə yaxın olacaqdır»[1089].

**51.** ***Kəbənin Yıxılması*:** Abdullah b. Amr - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həbəşili Zul Sevikateyn Kəbəyə gələcək, zinətlərini yığacaq, örtüyünü çıxaracaqdır. Əyri ayaqlı bir kimsə olaraq Kəbənin daşlarını bir-bir sökəcəkdir. Həbəşili olub Allahın beytini yıxacaqdır»[1090]. İbn Ömər, Əbu Hureyrə, İbn Abbas - *radıyallahu anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kəbəni iki ayağı zəif olan Həbəşili birisi sökər. Örtüyünü çıxarır və daşlarını tək-tək sökər (Başqa rəvayətdə: Tək-tək sökdüyünü görürəm)"[1091]. Əbu Hureyrə, Əbu Qatadə - *radıyallahu anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həcərul Əsvəd ilə İbrahim məqamı arasında bir adama beyət edilir. Kəbənin dəyərini yalnız onun xalqı qaldırır. Əgər bu olarsa artıq ərəblərin yox olmasından qaçılmışdır. Sonra Həbəşilər gəlir. Kəbəni sökərlər və ondan sonra Kəbə bir daha inşa edilməz. Kəbəni sökərək onun içində olan xəzinələri götürərlər (Başqa rəvayətdə: Kəbənin üzərinə çıxar və onu sökər[1092])"[1093].

**52.** ***Fıratın Suyunun Quruması*:** Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Firat suları quruyub qızıldan bir dağ ortaya çıxarmadıqca qiyamət qopmayacaqdır. O, qızılı ələ keçirmək üçün insanlar bir-birləri ilə savaşacaqlar. Savaşa qatılan hər yüz nəfərdən doxsan doqquzu öldürüləcəkdir. Hər kəs də o, qurtulan kimsənin mən olduğunu ümüd edirəm deyəcəkdir. Kim o, vaxtı orada olarsa oradan bir şey götürməsin»[1094].

---

[1086] Müslim «Fitən» 78.
[1087] Nəvəvi Şərhi, Müslim "Fitən" 18/22.
[1088] Müslim «Fitən» 78.
[1089] Tirmizi 2240.
[1090] Əhməd 2/220, Buxari «Həcc» 49, Müslim «Fitən» 59.
[1091] Fəthul-Bəri, Buxarî "Hacc" 3/460, Nəvəvi Şərhi, Müslim "Fitən" 18/35, Musnəd 12/14-15, H. 7053, Əhməd Şakir "Səhih".
[1092] Musnəd 15/227, H. 8080, Əhməd Şakir "Səhih".
[1093] Musnəd 15/35, Əhməd Şakir "Səhih", əl-Albâni "Sahih Hadislər" 2/120, H. 579.
[1094] "Fəthul-Bəri, Buxari "Fitən" 13/78, "Nəvəvi Şərhi", Müslim "Fitən" 18/18.

**53.** ***Ərəbistan Yarmadasının Yaşıllığa Bürünməsi*****:** Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ərəb yarmadası bitkili (yaşıllı) və çaylar axan bir əraziyə dönmədikcə Qiyamət qopmayacaqdır»[1095]. Muaz b. Cəbəl - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Təbuk döyüşü zamanı buyurdu: "***İnşallah,*** siz sabah Təbuk ərazisində olan (su quyusuna) bulağa çatacaqsınız. Gündüz olmadan ora girməyin. Sizdən kim ora çatarsa mən gəlmədən oranın suyuna əl sürtməsin. Biz oraya çatdıqda artıq bizdən öncə iki nəfər ora gəlmiş və quyudan ayaqqabı bağı kimi incə su axırdı. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – o, iki adama: "Bu suya əlinizi sürtdünüzmü?". Onlar: "Bəli" dedilər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onları danladı. Sonra o, quyunun (axmış) suyunu ovucu ilə götürərək bir şeyin içinə doldurdu. Əllərini və üzünü yudu. Qalan suyu quyunun içinə boşaltdı. Quyunun suyu artı. Oradakılar bol-bol ondan içdilər. Peyğəmbər: "Ey Muaz! əgər sənin ömrün uzun olarsa buranın baxçalarla dolu olduğunu görəcəksən"[1096].

**54.** ***İnsanların Şərlilərinə Etimad Edilməsi:*** Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamətdən öncə aldadıcı illər olacaqdır. O, illərdə doğrular yalan, yalançılar doğru danışarlar, güvənilir bir kimsə xəyanət edər, xain kimsəyə güvənilir və dəyərsiz kimsələr söz sahibi olurlar»[1097].

**55.** ***Yağışların Çoxalması:*** Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamətə yaxın göydən o, qədər yağış yağar ki, ondan qorunmaq üçün kərpiç evlər yetərli olmaz. Dəridən çadırlar qurarlar"[1098]. Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamətə yaxın bir il yağış yağar, lakin yerdən bir bitki də bitməz"[1099].

**56.** ***Heyvanların Və Əşyaların Danışması*****:** Əbu Səid - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Canım əlində olan Allaha and olsun ki, vəhşi heyvanlar insanlarla danışmadıqca, insanın qılıncının ucu, ayaqqabılarının bağı və ailəsinin (o, evdən çıxdıqdan) sonra nələr etdiyini baldırı ona bildirmədikcə Qiyamət qopmayacaqdır»[1100]. Əbu Hureyrə - *radıyallahu anhu* – ravayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir nəfər inəyin üzərinə minir. İnək insana baxaraq dilə gəlir və: «Mən bunun üçün yaradılmadım. Lakin mən əkinçilik üçün yaradıldım». Xalq heyrət və qorxu ilə: «***Subhənəllah!*** Danışan bir inək» dedilər. Peyğəmbər: «Mən (onun danışmasına) inanıram. Əbu Bəkr və Ömər də inanırlar» deyə buyurdu. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir çoban qoyun sürüsü içərisində olduğu vaxt bir canavar sürüyə hücum edib qoyunlardan birini götürür. Çoban da canavarı təqib edərək qoyunu ondan alır. Bunun üzərinə qurd çobana: «Mənim onların arasında qalacağım gün, qocaldığından dolayı onların məndən başqa bir çobanı da olmayacağı gün, onları məndən kim qurtarır?» dedi. Xalq: «***Subhənəllah!***» dedilər. Peyğəmbər:

---

[1095] Müslim «Fitən» 29.
[1096] Nəvəvi Şərhi, Müslim "Fədail" 15/40,41.
[1097] Əhməd 2/338.
[1098] Musnəd 13/291, H. 7554, Əhməd Şakir "Səhih".
[1099] Nəvəvi Şərhi, Müslim "Fitən" 18/30, Musnəd 3/140, Heysəmi "Məcmauz-Zəvaid" 7/330.
[1100] Əhməd "Musnəd" 3/84, Tirmizi "Fitən" 6/409, əl-Albâni "Səhih Hədislər" 1/31, H. 122.

«Mən (onun danışımasına) inanıram. Əbu Bəkr və Ömər - *radıyallahu anhum* – də inanırlar» deyə buyurdu[1101].

**57.** ***Keysər Və Kisra Olmayacaqdır*:** Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «(Bizans imperatoru) Keysər öldükdən sonra başqa bir Keysər (Sasani hökmüdarı) Kisra öldükdən sonra başqa bir Kisra gəlməyəcəkdir. Canım əlində olan Allaha and olsun ki, onların xəzinələrini Allah yolunda xərcləyəksiniz»[1102].

**58.** ***Kaxtanlının Çıxması*:** Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Kahtandan insanları dəyənəyi ilə idarə edən bir adam çıxmadıqca qiyamət qopmaz»[1103]. Axır zamanda Kaxtan qəbiləsindən bir adam çıxar və insanlar ona dini lider olaraq itaət edərlər və ətrafında toplanırlar. Qurtubi – *rahmətullahi aleyhi* - deyir ki: "İnsanları dəyənəyi ilə idarə edən bir adam" sözünün mənası: İnsanları doğru yola sövq etməsi, ona bağlamasıdır. Hədisdə isə onun insanlara qarşı sərt və kobud olması başa düşülür"[1104]. Bu sərtlik hər kəsə qarşı deyildir. Yalnız həddi aşan günahkarlara qarşıdır. O, isə dürüst bir kimsə və ədalətlə hökm edər. İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki: "Qaxtanlı adam, hamısı saleh kimsələrdir"[1105].

**59.** ***İlk Dəniz Savaşı Edən Ordu:*** Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Ümmətimin dəniz savaşı edəcək olan ilk ordusuna Cənnət vacib olmuşdur. Ümmu Haram[1106] - *radıyallahu anhu* – deyir ki: «Ya Rəsulullah! Mən o, orduda olacağammı?». Peyğəmbər: «Sən o, ordudakı əskərlər arasında olacaqsan» deyə buyurdu. Peyğəmbər: «Kayserin şəhərinə (***İstambul***) savaşmağa gedən ümmətimin ilk ordusu bağışlanmışdır» deyincə mən: «Ya Rəsulullah! Mən də onların arasında olacağammı?» deyə soruşdum. O: «Xeyr» deyə cavab verdi[1107].

**60.** ***Xəlifəlik Qureyşdəndir:*** Cabir b. Səmura - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «On iki xəlifə olacaqdır. Hamısı da Qureyşdəndir»[1108]. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Xəlifəlik məndən sonra otuz ildir»[1109]. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «On iki münafiq vardır. Bunlar Cənnətə girməzlər və dəvə iynənin dəliyindən keçənə qədər onu iyisini belə hss etməzlər»[1110].

**61.** ***Ən Xeyirli Əsr*:** İmaran b. Hüseyn - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Ümmətimin ən xeyirliləri mənim zamanımdakılardır. Sonra onların ardıyca gələnlərdir». Səhabə deyir ki, bilmirəm iki, yoxsa üç nəsil zikr etdi. Sonra sözünə davam edərək: «Sizdən sonra elə bir qövm gəldi ki, şahidliləri istənməyəcəkdir, lakin şahidlik edəcəklər. Xainlik ediləcəkdir, onlara güvənilməyəcəkdir. Nəzir deyəcəklər, lakin yerinə yetirməyəcəklər…»[1111].

---

[1101] Müslim 2388.
[1102] Buxari «Əyman» 3, Müslim «Fitən» 75.
[1103] Buxari «Fitən» 23, Müslim «Fitən» 2910.
[1104] "ət-Təzkira" s: 635.
[1105] "Fəthul-Bəri" 6/535.
[1106] Ummu Haram - *radıyallahu anhu* – Hicrətin **27**-ci ilində Muaviyə - *radıyallahu anhu* – ilə birlikdə Kibris savaşına qatılmışdır. O, dəniz döyüşlərində vəfat edir. Müslim «İmarə» 161.
[1107] Buxari «Cihad» 93.
[1108] Buxari, Müslim.
[1109] Əhməd 5/220, Əbu Davud «Sünnə» 8, Tirmizi «Fitən» 48.
[1110] Müslim 2779,2780. Bəzi mənbələrə görə Təbuk səfərindən dönərkə Aqabə gecəsində Peyğəmbər – *sallallahu aleyhi və salləm* – sui qəsd etmək istəyən kimsələrdir. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Münafiqin məsəli iki qoyun sürüsü arasında (hansı sürüdən olduğunu bilməyərək) gah oyana, gah da bu yana çaşqın gedən qoyuna bənzər» Müslim 2784.
[1111] Buxari, Müslim «Fitən» 42.

Həyasızlığın ortaya çıxması, düşmənçiliyin, nifrət etməyin, kin saxlamağın çoxalması, insanların çılpaq geyinib çölə çıxmaları və s. səhih hədislərlə sabit olunmuş bir çox əlamətlər vardır[1112]. Elə bir dəhşətli dövran gələcəkdir ki, zülmət qaranlığı kimi fitnələr meydana çıxacaqdır. Bu fitnələrin meydana çıxdığı zaman Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Gecə qaranlığı kimi öldürücü fitnələrdən çəkinin. (Xeyirli əməllər etməyə çalışın!) Çünki səhəri mömin olan axşama kafir olacaqdır, axşamı mömin olan isə səhərə kafir olacaqdır. İnsanlar öz imanlarını (dinlərini) dünya malına satacaqlar»[1113]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yeddi şey gəlmədən öncə yaxşı əməllər etməyə çalışın. Unutqanlıq gətirən fəqirlik, azdıran zənginlik, sağlamlığı pozan xəstəlik, yaşlılıq, qəfldən gələn ölüm, gözlənilən və bilinməyən şərlərin ən dəhşətlisi Dəccəl və ya daha qorxunc və acı olan Qiyamətdən başqa bir şeyimi gözləyirsiniz»[1114]. Allah bizi o, günlərdə qorusun! Amin!

## QİYAMƏTİN BÖYÜK ƏLAMƏTLƏRİ

Bunlar Qiyamətin yaxınlaşdığını bildirən əlamətlərdir. Bu əlamətlər ortaya çıxdığı vaxt qiyamət də onların ardı ilə gələcəkdir. Əhli Sünnə, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən gəldiyi şəkildə bu əlamətlərə inanırlar. Böyük əlamətlərin hansı sıra ilə meydana gələcəyini bəyan edən açıq bir dəlil yoxdur. Bu əlamətlər hədislərdə bir-birilərindən fərqli olaraq gəlmişlər. Huzeyfə b. Əsid əl-Ğifari - *radıyallahu anhu* – rəvayət edir ki, bizlər (Qiyaməti) müzakirə edən halda Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bizim yanımıza gəldi və: «Nəyi müzakirə edirsiniz?» deyə buyurdu. Orada olan səhabələr: «Qiyamət saatını müzakirə edirik» dedik. Peyğəmbər: «Sizlər on əlamət müşahidə etmədikcə əsla Qiyamət qopmayacaqdır!» və bunları zikr etdi: «Duhan (duman), Dəccəl, Dəbbətul Ard (heyvanın çıxması), Günəşin məğribdən doğması, İsa – *əleyhissəlam* – ın gəlməsi, Yəcuc və Məcucun çıxması, Biri şərqdə, biri qərbdə, biri də ərəb yarımadasında yerin batması və bütün bunlardan sonra Yəməndən xaric olan odun insanları toplanış yerinə aparması»[1115]. Xuzeyfə b. Useyd - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “On əlamət meydana gəlmədikcə Qiyamət qopmaz. Şərqdə bir çöküntü, qərbdə bir çöküntü, ərəb yarmadasında bir çöküntü, Duhan, Dəccal, Dabbatul Ard, Yəcuc və Məcuc, günəşin qərbdən doğması, Adenin dərinlklərindən çıxıb insanları önünə qatıb sürən atəş (Başqa rəvayətdə: İsa b. Məryəm enməsi)”[1116]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Altı şey gəlmədən öncə yaxşı əməllər etməyə çalışın. Duhan, Dəccal, Dabbatul Ard, (Başqa rəvayətdə: Günəşin qərbdən doğması) Sizdən birinizin başına gələcək şey, bütün hər kəsin başına gələcək şey”[1117]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Üç şey görüldükdə daha öncə inanmamış və imanında xeyir qazanmamış kimsəyə imanı fayda verməz. Günəşin batdığı yerdən doğması, Duman və Dəbbətul Ard»[1118]. Əbu Zərr - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bu günəş hara gedir

[1112] Bu haqda geniş məlumata Buxari, Müslim, Əbu Davud, Tirmizi və s. hədis kitablarına baxa bilərsiniz.
[1113] İmam Nəvəvi “Şərh Müslim” 2/133.
[1114] Tirmizi 2307.
[1115] Müslim.
[1116] Nəvəvi Şərhi, Müslim “Fitən” 18/27,28.
[1117] Nəvəvi Şərhi, Müslim “Fitən” 18/87.
[1118] Müslim, Əhməd 2/445, Tirmizi «Təfsir» 6.

bilirsinizmi?». Səhabələr: «Allah və Rəsulu daha gözəl bilir» dedilər. Peyğəmbər: «Bu günəş ərşin altına çatıncaya qədər gedər və səcdə edər halda qapanır və bu halda da qalır. Nəhayət ona: «Yüksəl, gəldiyin yerdən geri dön!» deyilər. O, da dönər və doğduğu yerdən təkrar doğar. Sonra hər dəfə təkrar belə edir… Nəhayət Qiyamətə yaxın ona: «Qalx, batdığın yerdən doğ!» deyilər. O, da məğrib tərəfdən doğar. Peyğəmbər: «Bu nə vaxtdır bilirsinizmi?» deyə buyurdu. ***«Rəbbinin bəzi qiyamət əlamətləri gələcəyi gün əvvəlcə iman gətirməmiş və ya imanında bir xeyir qazanmamış şəxsə** (sonrakı) **imanı heç bir fayda verməz…». (əl-Ənam 158)***[1119]. ***«Günəş də özü üçün müəyyən olunmuş yerdə seyr edər».*** *(Yəsin 38).* ***«Günəş və ay müəyyən bir ölçü ilə** (hərəkət edər)**».*** *(ər-Rahmən 5).* Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Əlamətlərin bir-birinin ardıyca gəlməsi ipə düzülmüş mirvari dənələrinin (qırıldığı) zaman tökülməsi kimidir”[1120]. Abdullah b. Amr - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Əlamətlər ipə düzülmüş mirvari dənələri kimidir. Əgər ip qırılarsa hamısı dənə-dənə düşər”[1121].

**1.** ***Duman:*** Qiyamət saatından bir qədər əvvəl baş verən böyük hadisələrdən biri də dumanın gəlməsidir. ***«(Ya Peyğəmbər!) Sən səmanın aşkar bir duman gətirdiyi günü gözlə. İnsanları** (bu duman) **bürüyəcəkdir. Bu ağır bir əzabdır».** (əd-Duxan 10-11).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Duhan (duman) təsiri möminə zökəm kimi gəlir, kafirə isə çox şiddətlidir”[1122].

**2.** ***Məsih Dəccəl: Məsihin Mənası:*** Qurtubu – *rahmətullahi aleyhi* - bu kəlimənin **23** çeşit mənası olduğunu söyləyir[1123]. Ayrıca bu kəlimə həm “***Doğru Söyləyən***” həm də “***Azdıran Yalançı***” mənalarını da daşıyır. Məsih İsa - *əleyhissəlam* - doğru söyləyən. Məsih Dəccəl isə insanları azdıran yalançıdır. Allah iki Məsih yaratmışdır. Biri digərinin ziddidir. Həmçinin iki gözündən biri məsh edildiyi üçün belə adlanır. ***Dəccəlin Mənası:*** **1.** ***Dəccəl –*** dəcələ sözündən götrülüb, aldatmaq deməkdir. ***Dəcəlun –*** çox yalan danışan, aldadan deməkdir. Haqqı yalanla örtdüyü üçün bu ad verilmişdir[1124]. İbn Həcər – *rahmətullahi aleyhi* - deyir ki: “Məsih Dəccəlin Qurani Kərimdə zikr edilməməsinə səbəb onun zəlil olması, alçaldılması üçündür”[1125]. **2.** ***Dəccəl –*** Dəcl kəliməsindəndir. Dəvə yara-xora basdıqda onu qatran ilə boyayırlar və buna da ***Dəcl*** deyilir. Qatrana ***Ducel – Ducalə*** deyilir. Dəccəl də öz sehrini qatranla boyayıb örtəcəkdir. **3.** ***Dəccəl –*** qızılı suya boyamaq deməkdir. Bir kimsə qılıncını qızıl suyu ilə boyadım dedikdə Dəcəltu ləfzini işlədir. **4.** ***Dəccəl –*** örtmək mənasındadır. O, insanları öz küfrü ilə örtər[1126].

***Peyğəmbər – Sallallahu Aleyhi Və Səlləm – İn Məsih Dəccəldən Allaha Sığınması:*** İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu duanı Quran surəsi öyrədir kimi bizə öyrədirdi: «Allahım! Cəhənnəm əzabından sənə sığınıram, qəbr əzabından sənə sığınıram, Məsih Dəccəlin fitnəsindən sənə sığınıram, ölümün və həyatın fitnəsindən sənə sığınıram”[1127]. İbn

---

[1119] Buxari, Müslim «İman» 250.
[1120] Heysəmî “Məcmauz-Zəvâid” 7/331, əl-Albânî “Camius-Sağir” 3/110, H. 3222.
[1121] Musnəd 12/6-7, H. 7040, Əhməd Şakir “Səhih”, Heysəmî “Məcmauz-Zəvâid” 7/321.
[1122] Əbu Davud.
[1123] “Təzkira” 679.
[1124] Fəthul Bəri 13/91, İbn Kəsir «Cəmiul Üsul» 4/204.
[1125] “Fəthul Bəri” 13/98, İbn Kəsir “Nihayə” 1/166-169.
[1126] Lisanul Arab 11/236, Qurtubi “Təzkira” 744, Fəthul Bəri 13/91.
[1127] Müslim “Məsəcid” 588,589, Tirmizi 3494, Əbu Davud 1542, İbn Məcə 3840.

Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – namazın sonunda dörd şeydən Allaha sığınardı: "Qəbir əzabından Allaha sığınıram, Cəhənnəm əzabından Allaha sığınıram, açıq və gizli fitnələrdən Allaha sığınıram və tək gözlü yalançı (Dəccəldən) Allaha sığınıram (Başqa rəvayətdə: Həyatın və ölümün fitnəsindən Allaha sığınıram[1128])"[1129].

***Məsih Dəccəl Haradan Çıxacaqdır:*** Əbu Bəkr – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Dəccəl şərq ölkəsində meydana gələcəkdir. Ora Xorasan adlanır. Abırsız və həyasız insanlar ona qoşulacaqlar (ona üzləri qalxanın dərisi kimi olan bir qövm tabe olur)»[1130]. Nəvvas b. Səman - *radıyallahu anhu* – rəvayət edir ki, bir gün səhər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bizə Məsih Dəccəl haqqında danışmağa başladı.... Heç şübhəsiz ki, o Şam ilə İraq arasında olan bir yolda ortaya çıxacaqdır. Sağına da, soluna da öz fitnə-fəsadını yayacaqdır. Ey Allahın qulları imanda möhkəm olun!...»[1131]. Ənəs b. Məlik – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Şübhəsiz ki, o İsfəhandan çıxacaqdır (Başqa rəvayətdə: Kufədən çıxacağıda söylənilir[1132])"[1133]. İbn Kəsir – *rahmətullahi aleyhi* - deyir ki: "Dəccəlin zühuru başlanğıc olaraq İsfəhanın "Yəhudiyyə" məntəqəsindən olur və **70** min Yəhudi silahları ilə ona tabe olurlar. Əyinlərində yaşıl Tayalisi (Yaşıl Persiya əbasına deyilir) libası olur. Yenə tatarlardan **70** min nəfər ona kömək edər və Xorasanda bir çox kimsə ona tabe olar"[1134].

***Məsih Dəccəldən Qorunma Yolu:*** Əbu Dərdə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kim Kəhf surəsinin əvvəlindən on ayə əzbərləyərsə Məsih Dəccəlin fitnəsindən qorunmuş olar"[1135]. Əbu Umamə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kim Dəccəlin atəşi ilə qarşılaşarsa Allahdan yardım istəsin və Kəhf surəsinin ön ayələrini oxusun. O, atəş ona İbrahim - *əleyhissəlam* - ın atəşin sərin və salamat olduğu kimi sərin və salamat olar"[1136]. Hişam bə Amr – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kim ona: Sən Rəbbimsən!" deyərsə fitnəyə düşər. Kim də: "Sən yalançısan, mənim Rəbbim Allahdır, Ona təvəkkül etdim" deyərsə ona zərər verməz və ya o fitnəyə düşməz"[1137].

***Məsih Dəccəlin Vəsfləri:*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Gözlənilən yeddi şey gəlmədən öncə əməllər edin: Hər şeyi unutduran fəqirlik, azdıran zənginlik, sağlamlığı pozan xəstəlik, əldən salan qocalıq, yaxadan yapışan ölüm və bunların da ən pisi olan Dəccəl. Qiyamət isə daha dəhşətli və qorxuludur"[1138]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «...Onun arxa tərəfində saçı qısa, qıvrım, sağ gözü kor birini də gördüm. Gözü su üzərindəki üzüm dənəsi kimi pırtlağdı.

---

[1128] Buxari "Azan" 833, 1/463, Müslim "Məsəcid" 590, 1/286.
[1129] Əhməd 1/305, Tayalisi 1/353, Buxari "Tarixul Kəbir" 2/119.
[1130] Əhməd 1/47, Tirmizi 2237, İbn Məcə 4072, Həkim 4/573, əl-Albani «Səhih Hədislər Silsiləsi» 4/122 hədis 1591.
[1131] Müslim "Fitən" 2252, Əbu Davud 4321, Tirmizi 2240, İbn Məcə 4075.
[1132] Məcmuaz Zəvaid 7/350-351, Təbərani 9/93, İbn Əbi Şeybə 7/496, İbn Məsud və Abdullah b. Amr yolu ilə.
[1133] Müslim 2266, İbn Hibban 15/209, Fəthul Bəri 13/328.
[1134] Nihayə 1/174.
[1135] Müslim 809.
[1136] İbn Məcə 4077.
[1137] Əhməd 5/13,372,410, Təbərani 7/221,265, Məcmuaz Zəvaid 7/341, AbdulBər "Təhmid" 14/193.
[1138] Tirmizi 2306, Həkim 4/516, Beyhəqi "Şuabul İman" 10572, Zəhəbi "Mizan" 6/30.

İbn Katana bənzəyirdi[1139]. Əllərinin birini çiyninə dayamış halda Beyti təvaf edirdi. Kimdir bu? deyə soruşdum. «Məsih Dəccəldir» deyə cavab verdilər"[1140]. Ubadə b. Samit – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Məsih Dəccəl qısa boylu, qıvrım saçlı, gözü əyri üzə çıxmış bəlli olmayan şəkildə qorxunc bir adamdır. Sizi inandıracaq şəkildə yalan danışar. Halbuki sizin Rəbbiniz tək göz deyildir"[1141]. İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Dəccəlin gözü kordur. Nə çox qara (dərili), nə də çox ağ (dərilidir). Başı ilan və ya kərtənkələ başı kimidir (Başqa rəvayətdə: "Vücudu iri, saçları ağac budaqları kimi bir-birinə girmişdir"[1142])"[1143]. Kab b. Ahbər - *radıyallahu anhu* – rəvayət edir ki: "Dəccəlin bir əli digərindən uzundur"[1144]. Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Dəccəli sağ gözü kor və divarda köpmüş suvaq kimidir. Mirvariyə oxşar sol gözü isə ulduz kimi parlar"[1145]. Xuzeyfə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Sağ gözü məsh olunmuş, digər gözü isə günəş kimidir"[1146]. Səfinə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Sol gözü kor, sağ gözü ət ilə örtülmüş kimidir"[1147]. Keçən hədislərdə Dəccəlin sağ gözü kor (əyri) ikən, bəzi rəvayətlərdə isə sol gözü kor (əyridir). Bu rəvayətləri hər biri də səhihdir. İbn Həcər – *rahmətullahi aleyhi* - deyir ki: "Buxari və Müslimdə keçən İbn Ömər – *radıyallahu anhu* – nun Dəccəl barəsində hədisdə sağ gözü kordur hədisi Müslimdə keçən sol gözü kordur hədisindən daha çox tərcih edilir. Çünki Muttafiqun Aleyh hədisi digərlərindən daha qüvvətlidir[1148]. Qadi İyad – *rahmətullahi aleyhi* - deyir ki: "Dəccəlin iki gözü də əlildi. Çünki rəvayətlərdə belə keçir. Kor olan gözü sağ gözüdür. O, da İbn Ömər – *radıyallahu anhu* – nun rəvayətində keçir. Üzərində görməyə əngəl olan pərdəli göz isə sol gözüdür. Göz dəliyindən çıxmış, ulduz kimi parlayan, divarda bəlğəm və ya köpmüş suvaq kimi olan sol gözdür. Beləki onun həm sağ, həm də sol gözü əlildir. Kor olan sağ gözü heç nə görməz, digər qüsurlu gözü isə nuru sönmüş, görmə qabiliyyəti isə azalmışdır. İmam Nəvəvi – *rahmətullahi aleyhi* - bu görüş üçün: "Ən gözəl sonluqdur" demişdir. Qurtubi – *rahmətullahi aleyhi* - bu görüşü tərcih etmişdir[1149].

***Kəf, Fə, Ra – Kafir Yazısı*** - İbn Ömər, Ənəs b. Məlik - *radıyallahu anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «...Dəccəlin iki gözü arasında kafir yazılmışdır. Oxuya bilən və oxuya bilməyən hər bir mömin bu kəlməni oxuyacaqdır (Başqa rəvayətdə: "İki gözünün arasında "***Kafir***" yazılmışdır dedi və hecaladı: ***Kəf, Fə, Ra*** – bunu da hər bir müsəlman oxuyacaqdır"[1150])»[1151]. İmam

---

[1139] ***İbn Katan*** - AbdulUzza b. Katan b. Amr əl-Huzâi - Annası Xədicə – *radıyallahu anhə* – nin bacısı Halə b. Xuveyliddir. Cahiliyyə dönəmində ölmüşdür. "İsabə" 4/239, "Fəthul-Bâri" 6/488, 13/101.
[1140] Buxari «Ənbiya» 48, Müslim «İman» 272.
[1141] Ebu Davud "Avnul-Mabud" 11/443, əl-Albani "Camius Sağir" 2/317-318, H. 2455.
[1142] Təbərani 11/313, Əhməd 1/374, Fəthul Bəri 13/108.
[1143] Əhməd 1/240,313, İbn Hibban 1/468, Təbərani 11/273, Məcmuaz Zəvaid 7/337,338.
[1144] Fəthul Bəri 13/92, İbn Qudamə "Muğni" 8/358.
[1145] Əhməd 3/79, 1,374, Məcmuaz Zəvaid 7/346, Fəthul Bəri 13/98, İbn Kəsir 1/588, Təbərani 11/313.
[1146] Həkim 4/573, Zəhəbi "Munkər" hədis.
[1147] Tayalisi 1/150, Təbərani 7/84, İbn Əbi Şeybə 7/491, Əhməd 5/221, Fəthul Bəri 13/98.
[1148] Xuzeyfə - *radıyallahu anhu* – rəvayət edir ki: "Kor olan gözü sol gözüdür". Müslim 2248, "Fəthul Bəri" 13/97.
[1149] Müslim, Nəvəvi Şərhi 2/235, "Təzkira" s: 663, Fəthul Bəri 13/97, Tuhfətul Əhfəzi 6/421.
[1150] Müslim 2245, 2249, Tirmizi 2235, Əhməd 5/386, 3/206, İbn Məcə 4077, Fəthul Bəri 13/100, Tuhfətul Əhfəzi 6/409, İbn Kəsir 1/581, Qurtubi 13/353,
[1151] Buxari 2608, Müslim 2248.

Nəvəvi – *rahmətullahi aleyhi* - deyir ki: “Alimlərin üzərində ittifaq etdiyi bu görüş bu yazının həqiqət olduğudur. Allah bu yazını Dəccəlin kafir, yalançı və batil olduğunu ortaya çıxarmaq üçün bir əlamət etmişdir. Oxuma və yazma bilən və bilməyən hər bir möminə bu yazını göstərir. Onunla imtahan etmək istədiyi asi kimsələrdən də bunu gizlədir. Artıq bundan qaçmaq yoxdur”[1152].

***Məsih Dəccəlin Ana Və Atası:*** Abdullah b. Mutim - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dəccəlin qulağı kəsikdir”[1153]. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dəccəlin uşağı olmaz və nə Mədinəyə, nə də Məkkəyə girməz”[1154]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Gözü kor, alnı açıq, sinəsi geniş və əyriliklərlə doludur”[1155]. Əbu Bəkrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dəccəlin ana və atasının **30** il övladları olmaz. Sonra kor bir uşaqları olur”[1156]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Dəccəlin ana və atasını vəsf etdi: “Atası – uzun boylu, zəif cəsədli, burnu uzundur. Anası – iri bədənli, iri sinəli bir qadındır” deyə buyurdu[1157]. Həfsə b. Ömər - *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dəccəlin ortaya çıxmasına səbəb onu qəzəbləndirən bir şey səbəb olacaqdır”[1158]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dəccələ ilk olaraq qadınlar tabe olacaqdır və ona əziyyət verəcəklər. Bundan sonra öz xəndəyinə qəzəbli bir vəziyyətdə dönəcəkdir”[1159].

***Məsih Dəccəl Hansı Şəhərlərə Girə Bilməz:*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qurtuluş günü! Qurtuluş günü nədir? Bu sözünü üç dəfə təkrar etdi. Dəccəl Uhud dağına çıxar. Mədinəya baxar və adamlarına: – «Bu ağ qəsri görürsünüzmü? Bu Əhmədin məscididir. Sonra Mədinəyə tərəf gəlir və hər iki qapısında Mələk görür. Bundan sonra Mədinə üç dəfə sarsıntı keçirir. Münafiq kişi və qadın, fasiq kişi və qadın oradan çıxarlar»[1160]. Əbu Bəkrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Məsih Dəccəl Mədinəyə girməz. O, zaman Mədinənin **7** qapısı vardır və hər qapıda iki mələk vardır”[1161]. Abdullah b. Amr - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “(Dəccəl) Kəbəyə və Beytul Məqdisə girməz (Başqa rəvayətdə: Dörd yerə girməz: Kəbə, Məscidul Nəbəviyyə, Məscidul Aqsa və Tur (dağı)[1162])”[1163].

***Məsih Dəccəl Barəsində Varid Olan Hədislər:*** Sab b. Cusamə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “İnsanlar Dəccəli unutmadıqca, imamlar minbərlərdə ondan danışmağı kəsmədikcə Dəccəl meydana

---

[1152] Müslim, Nəvəvi Şərhi 18/80.
[1153] Fəthul Bəri 13/91, Məcmuaz Zəvaid 7/340, İbn Əbi Şeybə 7/497.
[1154] Müslim 2241, Tirmizi 2246.
[1155] Əhməd 2/291, Məcmuaz Zəvaid 7/346, Təbərani 18/335, İbn Əbi Şeybə 7/488.
[1156] Tirmizi 2248, İbn Əbi Şeybə 7/492, Əhməd 5/40, Fəthul Bəri 13/326.
[1157] Tirmizi 2248, İbn Əbi Şeybə 7/492, Əhməd 5/40,49,51.
[1158] Müslim 2246, İbn Hibban 15/204, Təbərani 23/210, Əhməd 6/284.
[1159] Təbərani “Əvsat” 5/331, Məcmuaz Zəvaid 7/349.
[1160] Əhməd 4/338, Həkim 4/586, Deyləmi 8992.
[1161] Buxari 2/664, 6/2607, İbn Hibban 9/48, 15/29,216, Həkim 4/583, Məcmuaz Zəvaid 7/332, İbn Əbi Şeybə 6/406, 7/492, Fəthul Bəri 10/191.
[1162] Əhməd 5/364,434, Fəthul Bəri 13/105.
[1163] Qurtubi 4/89, Məcmuaz Zəvaid 7/350, Fəthul Bəri 13/104.

çıxmaz"[1164]. Cabir b. Abdullah - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Dəccəl dindən qafil olduğu və elmdən üz çevrildiyi bir zamanda ortaya çıxar"[1165]. İmran b. Hüseyn - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Adəm – *əleyhissəlam* – ın yaradılmasından Qiyamətin qopacağı vaxta qədər Məsih Dəccəldən daha böyük bir fitnə olmayacaqdır»[1166]. Aişə, Əbu Umamətul Bahili - *radıyallahu anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən: "Ya Rəsulullah! O, zaman insanların yeyəcəyi nə olacaq?". O: "***Təhlil, Təkbir, Təsbih*** və ***Təhmid*** onlar üçün yemək yerini tutacaqdır" deyə buyurdu[1167]. İmran b. Hüseyn - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dəccəl barəsində eşidən mütləq qaçacaqdır. Allaha and olsun ki, onun yanına gələn onu mömin hesab edəcəkdir. Onun ardınca gedəcəkdir. Yanına gələndə ona qarşı şübhə hisləri meydana gələcəkdir və yaxud o, şübhə doğuracaqdır»[1168]. Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Məkkə və Mədinə müstəsna Dəccəlın ayaq basmadığı torpaq qalmayacaqdır. Məkkə və Mədinənin hər girəcəyində mələklər durub bu şəhəri qoruyacaqlar (Başqa rəvayətdə: «Mədinə və əhalisi üç dəfə sirkələnəcəkdir. Mədinədə bir nəfər belə münafiq kişi və qadın qalmaz. Hamısı onun (Dəccəlin) yanına gedirlər[1169])»[1170]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mədinəyə Vəba və Dəccəl girməz»[1171]. Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İsfəhan yəhudilərindən **70** nəfər əyinlərində Tayalisə[1172] olaraq Dəccalin ardıyca gedəcəklər»[1173]. Ummu Şərik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnsanlar Dəccəlin şərrindən dağlara qaçacaqlar»[1174]. İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mən sizi Dəccəldən çəkindirirəm. Hər bir Peyğəmbər öz ümmətini ondan çəkindirmişdir. Nuh – *əleyhissəlam* – da öz qömünü ondan çəkindirmişdir. Lakin mən sizə elə bir söz deyəcəyəm ki, heç bir Peyğəmbər bunu öz ümmətinə deməmişdir. Dəccəl tək gözdür. Allah isə tək göz deyildir. Bilin ki, sizdən heç kəs ölənə kimi öz Rəbbini görməyəcəkdir. Dəccəlin iki gözü arasında kafir yazılmışdır. Oxuya bilən və oxuya bilməyən hər bir mömin bu kəlməni oxuyacaqdır»[1175]. Ribi b. Xiraş - *radıyallahu anhu* – rəvayət edir ki, bir gün Əbu Məsud əl-Ənsari ilə birlikdə Huzeyfə b. Yəmən - *radıyallahu anhu* – nun yanına getdik. Əbu Məsud, Huzeyfəyə: «Dəccəl haqqında Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən eşitdiyini bizə xəbər ver» dedi. Huzeyfə: «Dəccəl ortaya çıxacaq. Onunla bərabər su və atəş də olacaqdır. İnsanların su kimi gördükləri yandırıcı atəşdir. Atəş olaraq gördükləri isə soyuq və sərin sudur. Sizdən hər kim o, vaxta qədər yaşasa atəş gördüyü şeyin içinə girsin. Çünki o, sərin və soyuq sudur» Bundan sonra Əbu Məsud:

---

[1164] Əhməd 4/71, İbn Həcər "Təhzibu Təhzib" 4/369.
[1165] Əhməd 3/367, İbn AbdulBər "Təhmid" 16/180, Məcmuaz Zəvaid 7/344.
[1166] Müslim.
[1167] Əhməd 6/75,125, İbn Məcə 4077, İbn Kəsir 1/582, Məcmuaz Zəvaid 7/335.
[1168] İbn Kəsr «Cəmiul Üsul» 10/354, H. 7846, ən-Nəhayə 1/82.
[1169] İbn Məcə «Fitən» 33.
[1170] Müslim.
[1171] Buxari «Fitən» 27, Müslim «Fitən» 1379. Tirmizi «Fitən» 61.
[1172] ***Taylisa*** - Yaşıl Persiya əbasına deyilir.
[1173] Müslim 2944.
[1174] Müslim 2945.
[1175] Buxari2608, Müslim 2248.

«Mən də bunu Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən eşitdim» dedi[1176]. İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dəccəlin mənzili (Mədinə yaxınlığındakı) ərazidə olacaqdır. (Mədinədən) çıxıb onun yanına gedənlərin çoxluğunu qadınlar təşkil edəcəkdir. Belə ki, insan yoldaşının, anasının, bacısının və xalasının yanına dönəcəkdir. Dəccalın yanına getmələrindən qorxduğu üçün onları bağlayacaqdır. Sonra Allah müsəlmanları Dəccalın üzərinə salacaqdır. Müsəlmanlar onu və tərəfdarlarını öldürəcəkdir. Beləki Yəhudi, ağacın və daşın arxasında gizlənəcəklər. O, ağac və daş müsəlmanlara: «Burada arxamda bir Yəhudi var, gəl onu öldür» deyəcəkdir. Yalnız ***Ğarqad*** ağacından başqa. Çünki o, Yəhudilərin ağacıdır[1177]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Onun bir gözü kordur. Elə isə Allah kor deyirdir. Dəccəlin sağ gözü çuxurundan pırtlamış bir üzüm dənəsi kimidir»[1178].

Məsih Dəccəl Allahlıq iddiasında olacaqdır. İstədiyi hər şeyi Allahın izni ilə edəcəkdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dəccəlin fitnələrindən biri də budur ki, o gəlib bir ərəbə deyəcəkdir: «Mən sənin ölmüş ata-ananı diriltdib yanına gətirsəm sən şəhadət verəcəksənmi ki, mən sənin Rəbbinəm?» Ərəb: «Bəli» deyəcəkdir. Şeytan onun ata və anasının surətində zahir olub deyəcəkdir: «Oğlum! Ona itaət et. O, sənin Rəbbindir»[1179]. Cabir - *radıyallahu anhu* – rəvayət edir ki: "Allah dəccəlin yanında insanlarla danışan şeytanlar göndərəcək"[1180]. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dəccəl çıxdığı zaman möminlərdən biri onu görməyə gedir. Dəccəlın gözətçiləri onun qabağını kəsərək: «Hara gedirsən?» deyə soruşdular. Mömin: «Bu ortaya çıxan adamı görmək istəyirəm» dedi. Gözətçilər: «Yoxsa sən bizim Rəbbimizə inanmırsan» dedilər. Mömin: «Bizim Rabbimizdə bir gizlilik yoxdur» dedi. Gözətçilər: «Öldürün onu?» dedilər. Gözətçilərdən bir qismi: «Bizim Rəbbimiz deyib ki, onun icazəsi olmadan heç kəsi öldürməyin» demişdi. Mömini Dəccəlin yanına gətirirlər. Mömin Dəccəli görən kimi: «Ey insanlar! Bu peyğəmbərimizin bizə vəsf etdiyi Dəccəldir». Dəccəl əmr edir, mömini üzü üstə uzadırlar və Dəccəl: «Onu tutun. Başını yarın. Belinə, qarnına zərbələr endirin» deyir. Dəccəl: «İndi mənə iman gətirirsən?» deyir. Mömin: «Sən yalançı Məsihsən» deyir. Dəccəlin əmri ilə mömini mişar ilə iki hissəyə bölürlər. Sonra Dəccəl iki hissəyə bölünmüş cəsədin ortasından keçərək: «Qalx!» deyir. Cəsəd də dirilərək ayağa qalxır. Dəccəl yenə: «İndi mənə iman gətirirsən?» deyir. Mömin: «Mən sənin həqiqi Dəccəl olduğunu daha da yaxşı bildim» deyir. Mömin üzünü camaata tutaraq deyir: «Ey insanlar! O, məndən sonra heç kəsə bu əməli etməyəcəkdir». Dəccəl onu doğramaq üçün tutar. Lakin Allah mömimin boynu ilə boğazı arasını qoruyar. Dəccəl də ona heç bir şey edə bilməyib əllərindən və ayaqlarından tutub atar. İnsanlar elə zənn edərlər ki, (Dəccəl) onu oda atdı. Lakin o, Cənnətə atılacaqdır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «O, mömin aləmlərin Rəbbinin yanında şəhidlərin ən əzəmətlisi olacaqdır»[1181]. İmran b. Hüseyn - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ümmətimdən Qiyamət

---

[1176] Buxari 1272, Müslim 2249, 2250,
[1177] "Fəthul Bəri, Buxarî "Cihad" 6/103, Nəvəvî Şərhi, Müslim "Fitən" 18/44,45, İmam Əhməd "Musnəd" 5/16, 2/67, 417, Sünən İbn Məcə 2/1359-1363, H. 4077.
[1178] Əhməd 2/27, Tirmizi «Fitən» 60.
[1179] əl-Albani «Səhih Cəmius Səğir» 6/274, H. 7520.
[1180] Əhməd 3/367-368, Məcmuaz Zəvaid 7/344.
[1181] Buxari 2608, Müslim 2256.

saatı gəlincəyə qədər haqq üzərə savaşacaq olan kimsələr olacaqdır. Onlarla döyüşənlərə qarşı müzəffərdilər (yenilməz). Onların sonuncuları Məsih Dəccəllə qarşı döyüşən (camaatdır)» [1182]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Bəni Təmim mənə üç şeyə görə sevimlidir: Onlar ümmətim içində Dəccələ qarşı ən şiddətli olanlardır (döyüşənlər)..."[1183]. Nəvvas b. Səman - *radıyallahu anhu* – rəvayət edir ki, bir gün səhər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bizə Məsih Dəccəl haqqında danışmağa başladı. Onun haqqında səsini gah alçaldaraq, gah da yüksəldərək elə bir tərzdə danışdı ki, biz onu Nəhl (xurmalıq) deyilən bir yerdə zənn etdik. Biz onun yanına gəldikdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bizdə olan vəziyyəti görüb buyurdu: «Sizə nə olub?» Biz: «Ya Rəsulallah! Bu gün səhər Dəccəl haqqında səsini gah alçaldaraq, gah da yüksəldərək elə bir tərzdə danışdı ki, biz onu Nəhl (xurmalığ) deyilən bir yerdə zənn etdik». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizdən ötrü məni qorxudan şey Məsih Dəccəl deyildir. Əgər o, mən sizin içinizdə ikən ortaya çıxarsa, ona qarşı mən sizə kifayət edərəm. Yox əgər mən aranızda yox ikən o, ortaya çıxarsa onda hər kəs özü-özünü ondan müdafiə etməlidir. Allah da hər bir müsəlman üçün məni əvəz edər[1184]. Dəccəl gəncdir. Saçları olduqca qıvrımdır. Bir gözü əyridir (sanki üzüm salxımından irəli çıxmış üzüm giləsi kimi). Mən onu Abdul Uzza b. Katana bənzədirəm. Sizlərdən hər kim o, çıxan vaxtı yaşayarsa ona qarşı Kəhf surəsinin ilk on ayəsini oxusun[1185]. Heç şübhəsiz ki, o Şam ilə İraq arasında olan bir yolda ortaya çıxacaqdır. Sağına da, soluna da öz fitnə-fəsadını yayacaqdır. Ey Allahın qulları imanda möhkəm olun!» Biz: «Ya Rəsulallah! O, yer üzündə nə qədər müddət qalacaqdır?» deyə soruşduq. Peyğəmbər: «Qırx gün. (Bu günlərdən) Bir günü bir ilə, bir günü bir aya, bir günü bir cüməyə (bir həftə) bərabər olacaqdır. (O, qırx günün içində[1186]) Qalan günlər isə sizin günləriniz kimi olacaqdır» deyə buyurdu. Biz: «Ya Rəsulallah! Bu bir il qədər olan o, bir gündə bizlərə bir günün namazı kifayət edirmi?» deyə soruşduq. Peyğəmbər: «Xeyr! (kifayət etməz) Siz o, uzun gündə, adi günlərdə qıldığınız namaz vaxtlarını hesablayıb, namazlarınızı qılın!» deyə buyurdu. Biz: «Ya Rəsulallah! Dəccəl yer üzündə nə cür sürətlə yeriyəcəkdir?» deyə soruşduq. Peyğəmbər: «Küləyin qovduğu yağış buludlarının sürəti kimi!» deyə buyurdu. Peyğəmbər: «O, bir qövmün yanına gəlib onları dəvət edəcəkdir. Onlar da ona iman gətirib itaət edəcəklər. Bundan sonra o, göyə əmr edəcəkdir. Göy də onun əmri ilə yağış yağdıracaqdır. Sonra yerə əmr edər. Yer də hər cür bitkilərini bitirəcəkdir. O, qövmün otlağa çıxmış heyvanları axşam otlaqdan ən gözəl bir halda, məmələri süddə dolu, ətlənmiş bir halda geri qayıdarlar. Sonra Dəccəl digər bir qövmə gəlib onları da dəvət edər. Lakin o, qövm onun sözünü qəbul etməyib onu rədd edərlər. Dəccəl o, qövümdən uzaqlaşdıqdan sonra onları quraqlıq basar, bütün malları tələf olub gedər (Başqa rəvayətdə: «Dəccəlin çıxmasından əvvəl üç ilə şiddətli bir qıtlıq və quraqlıq olacaqdır. İnsanlar böyük bir aclığa məruz qalacaqlar. Birinci ili Allah göylərə yağışın üçdə birini, yerə isə içdə birini kəsməyi əmr edər. İkinci ili isə üçdə ikisini, üçüncü ili isə tamamən yağmurun yağmasını və yerə də bitkilərini bitirməsini qadağan edər. Heç

---

[1182] Əbu Davud "Cihad" 4, 2484, İmam Əhməd.

[1183] Buxari 2/898, 4/1587, Müslim 4/1957, İbn Hibban 15/219, Fəthul Bəri 5/172.

[1184] Yəni Allah hər bir müsülmana yolunu azmamaq və Dəccəlin fitnəsinə düşməmək üçün kömək edəcəkdir.

[1185] Başqa rəvayətdə son on ayəsini bilən Dəccəlin fitnəsindən qorunar. Müslim.

[1186] Əhməd 5/364, İbn Əbi Şeybə 7/495, Fəthul Bəri 13/105, İbn Kəsir 1/583, Məcmuaz Zəvaid 7/344. Başqa rəvayətdə: Yer üzündə 40 ilmi? 40 aymı? 40 günmü.

bir yaşıllıq bitməz və bir damla su da qalmaz. Bütün dırnaqlı canlılar ölür. Allahın dilədiklərindən başqa insanlar o. vaxt nə ilə dolanırlar? Deyə soruşduqda. Peyğəmbər: «***Təhlil, Təkbir, Təsbih*** və ***Təhmid*** ilə keçinirlər. Bu onlar üçün yemək yerinə keçər»[1187]). Dəccəl bir xarabalığın yanına gəlib: «Öz xəzinələrini çıxart!» deyər və bal arılarının (ana) arının ardınca düştükləri kimi xəzinələr də onun ardınca düşərlər».

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – sözünə davam edərək buyurdu: «Sonra gənc yaşına çatmış bir gənci yanına çağıraraq, onu qılınc ilə vuraraq iki hissəyə bölür. Parçalar oxun son düşmə məsafəsi qədər bir-birindən ayrılırlar. Sonra Dəccəl iki hissəyə böldüyü gənci çağırar, o da həmin (anda) üzü parıldayaraq və gülərək gəlir. Dəccəl öz fitnə-fəsadını yaydığı vaxt Allah Məryəm oğlu Məsihi, İsa – *əleyhissəlam* – ı göndərər. O, da iki paltara bürünmüş və əllərini iki mələyin qanadlarına qoyaraq Dəməşqin şərq tərəfindəki ağ minarəyə enər. Onun nəfəsinin iyini alan hər bir kafirə ölümdən başqa heç bir şey halal olmaz. Onun nəfəsi isə gözün son görmə həddinə qədər çatar. İsa – *əleyhissəlam* – Dəccəli axtarır. Nəhayət onu (Beytul-Məqdisə) yaxın bir yerdə Ludd qapısının yaxınlığın-da yaxalayaraq öldürər. Sonra İsa – *əleyhissəlam* – Allahın Dəccəlin şərindən qoruduğu bir qövmün yanına gələr. İsa – *əleyhissəlam* – onların üzərilərinə əli ilə toxunub məsh edir və onlara Cənnətdəki dərəcələrini söyləyər. Onlar bu halda olduqları vaxt Allah – *subhənəhu və təalə* -, İsa – *əleyhissəlam* – a: «Mən indi Mənə aid olan qullarımı çıxardacağam ki, heç bir kimsənin onlarla müharibə etməyə nə qüdrəti, nə də qüvvəti çatar! Lakin sən, ey İsa! Səninlə olanlara Tur dağında sığınacaq ver» deyə vəhy etdi. Allah Yəcuc və Məcuc tayfalarını göndərir. ***«Yəcuc və Məcuc** (səddinin) **açılıb onlar hər tərəfdən** (alçaq və yüksək təpələrdən) **sürətlə axışdıqları zaman».*** *(əl-Ənbiya 96).* Onların əvvəli Təbəriyyə gölünə yetişib onun suyunu içərlər, axırıncılar oradan keçərkən and olsun ki: «Nə vaxtsa burada su vardı» deyərlər. Allahın Peyğəmbəri İsa – *əleyhissəlam* – və onunla birlikdə olanlar mühasirədə qalacaqlar. Nəhayət onların birinə bir öküz başının dəyəri bu gün sizə görə yüz dinardan da xeyirli olur. İsa – *əleyhissəlam* – və səhabələri Allaha dua edərlər. Allah da (Yəcuc və Məcuc) onların boyunlarına qurdlar salar və səhəri hamısı məhv olub gedərlər. Sonra Allahın peyğəmbəri və onunla birlikdə olanlar yerə enərlər. Yer üzündə Yəcuc və Məcuc tayfasının cəsədlərindən bir qarış yer belə tapa bilməyəcəklər. Onların pis qoxusu aləmi bürüyəcəkdir. Allahın peyğəmbəri və onunla birlikdə olanlar Allaha dua edərlər. Bu dualarına cavab olaraq Allah dəvə boyunları kimi uzun boylu quşlar göndərər. Quşlar o, leşləri götürüb Allahın istədiyi yerə apararlar. Sonra Allah elə bir yağış göndərər ki, istər quru və sağlam palçıqdan olsun, istər gildən olsun heç bir ev o, yağışın enməsinə mane ola bilməyəcəkdir. Yağış bütün yer üzünü yuyacaqdır. Nəhayət yer üzü güzgü kimi parlayacaqdır. Sonra Allah yer üzünə: «Meyvələrini bitir, bərəkətini ver!» deyə əmr edəcəkdir. O, gün bir camaat bir narı yeyib doyarlar və qabığı altında kölgələnərlər. Bərəkət sürətlə artar. Hətta bir dəvənin südü böyük bir topluluğa kifayət edər. Bir inəyin südü bir qəbiləyə, bir qoyunun südü isə bir neçə ailəyə kifayət edər (Başqa rəvayətdə: «Həyatım əlində olan Allaha and olsun ki, Məryəm oğlu İsa adil bir hakim olaraq sizin içinizə enməsi yaxındır. O, xaçları sındıracaq, donuzları öldürəcək və cizyəni qaldıracaqdır, zəkatı buraxacaq, qoyundan və dəvədən zəkat alınmayacaq-dır, ədavəti, kin-kudurəti aradan qaldıracaqdır, hər zəhərllinin zəhərini çəkib alacaqdır. Belə uşaq əlini ilanın ağzına soxacaq amma ilan ona zərər verməyəcəkdir. Uşaq aslanı qovalayacaq amma aslan ona

---

[1187] İbn Məcə «Fitən» 33.

zərər verməyəcəkdir. Qoyunlar arasında qurd qoyunları qoruyan it kimi olacaqdır. Yer üzü barışla dolacaqdır. Hərkəsin sözü bir olacaqdır. Allahdan başqasına ibadət edilməyəcək, döyüşlər sona yetəcəkdir. Qureyşin hakimiyyəti əlindən alınacaqdır. Adəm – *əleyhissəlam* – ın zamanında olduğu kimi əkinlər bitəcək[1188]). Bu vaxt Allah xoş bir külək göndərər. Bu külək möminləri qoltuq altından yaxalayaraq bütün mömin və müsəlmanların ruhlarını alar. Yer üzündə insanların şərliləri qalar. Onlar orada heç bir kəsdən utanmadan eşşəklərin bir-biri ilə cinsi əlaqədə olduqları kimi, qadın və kişi bir-biri ilə cinsi əlaqədə olarlar. Qiyamət də onların üzərində qopar». Başqa rəvayətdə – Yəcuc və Məcuc tayfaları hər şeyi məhv etdikdən sonra Cəbəlil-Həmraya qədər gəlirlər. O, da BeytulMəqdisdə dağdır. «And osun ki, biz yer üzündə hər şeyi məhv etdik. İndi gəlin göydə olanları məhv edək!» deyib oxlarını göyə atarlar. Allah onların oxlarını qan ilə boyanmış olaraq rədd edər»[1189].

***İbn Səyyad:*** Nəccar oğullarındandır. Bəziləri qeyd edirlər ki, Nəccar oğullarından olan bir Yəhudi ailəsindəndir. Əsl adı Safii və ya Abdullah b. Səyyad və ya Saiddir[1190]. Sələf alimləri onun müsəlman olub olmadığı haqda ixtilaf etmişlr. Qeyd edirlər ki, o müsəlman olaraq kahinlik iddiasından, və peyğəmbərlik iddiasından əl çəkərək tövbə etmişdir. Mədinə də öldüyü və namazının da qılınması rəvayət edilmişdir. Öldükdə onun üzünü açaraq camaata da göstərmişlər ki, siz də onun öldüyünə şahid olunuz[1191]. Bəzi mənbələrə görə döyüşlərin birndə o, qeyb olur. Cabir - *radıyallahu anhu* – rəvayət edir ki: «İbn Səyyad Harre döyüşündə yox olur (nə dirilər içərisində, nə də ölüər içərisində onun cəsədi tapılmır)»[1192].

İbni Kəsir – *rahmətullahi aleyhi* - deyir ki: “Müsəlman olmuşdur. Oğlu Umarə Tabiin böyüklərindəndir. İmam Məlik – *rahmətullahi aleyhi* - və s. Ondan hədis rəvayət etmişlər[1193]. İmam Zəhəbi – *rahmətullahi aleyhi* - onun tərcümeyi halından danışmış. İbn Şahin ondan belə rəvayət edir: “İbn Saidin atası Yəhudi olub, doğularkən əyri gözlü və sünnətli olaraq doğulmuşdur. Buna görə də ona Dəccal deyilir. Sonra müsəlman olmuş, Tabiindir, Peyğəbər – *sallallahu aleyhi və səlləm* – i görmüşdür”[1194]. İbn Həcər – *rahmətullahi aleyhi* -, Zəhəbi – *rahmətullahi aleyhi* – nin dediklərini rəvayət etdikdən sonra deyir: “Oğlu Umarə, Səid b. Museyyibin xeyirli yoldaşlarındandır. İmam Malik – *rahmətullahi aleyhi* - və s. Ondan hədis rəvayət etmişlər. Onun barədə hədisləri zikr etdikdən sonra: “İbn Səyyad səhabə ola bilməz. Çünki o, Dəccəl olarsa səhabə olmaz kafir kimi ölər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə görüşdükdə onun müsəlman olmadığı sayılır”[1195]. Əgər sonra müsəlman olmuşsa Zəhəbi – *rahmətullahi aleyhi* - nin dediyi kimi Tabiin sayılır. İbn Səyyadın Dəccəl olduğu insanlar arasında yayılınca Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onu görmək üçün getdi və ona bir neçə sual verdi:

***İbn Səyyad Barədə Varid Olan Hədislər:*** İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, biz Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə birlikdə idik. İçərilərində İbn Səyyad olan bir qrup uşaqların yanına gəldik. Uşaqlar qaçdılar. İbn Səyyad isə oturdu.

---

1188 İbn Məcə «Fitən» 33.
1189 Müslim 2252.
1190 “Fəthul Bəri” 3/220-6/164, “Umdətul-Qâri” 8/170-14/278-303, “əl-Fitən vəl-Məlâhim” 1/128, Müslim, Nəvəvî Şərhi 18/46, “Avnul-Mabud” 11/478, “İthaful-Cemâa” 2/63-64.
1191 Fəthul Bəri 13/328.
1192 Əbu Davud «Məlahim» 4332, Avnul-Mabud 11/476.
1193 “əl-Fitən vəl-Məlâhim” 1/128, “Təhzibut-Təhzib” 7/418, 681.
1194 “Təcridu Əsməi Səhabə” 1/319, 3366.
1195 “əl-İsabə” 3/133, 6609.

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in ondan xoşlanmadığı bir halı var idi. Peyğəmbər: «Mənim Allahın Rəsulu olduğuma şəhadət edirsənmi?» deyə buyurdu. O: «Sən də mənim Peyğəmbər olduğuma şəhadət edərsənmi?» dedi. Peyğəmbər: «Cənnətin torpağı nədir?» deyə buyurdu. O: «O, yumşaq və bəyazdır, iyisi isə miskdir» dedi. Peyğəmbər: «Sən doğru dedin» buyurdu. Peyğəmbər: «Sən nə görürsən?» deyə buyurdu. O: «Mən su üzərində bir taxt görürəm» dedi. Peyğəmbər: «Sən dərya üzərində İblisin taxtını görürsən. Bundan başqa nə görürsən?» deyə buyurdu. O: «Mən bir (iki) doğru söyləyən və bir (iki) yalan söyləyən görürəm. Mənə doğru xəbər də gəlir, yalan xəbər də» dedi. O: «Qəlbimdə sənin üçün bir şey saxladım?» dedi. Peyğəmbər: «Nədir o!» deyə buyurdu. O: «***Duhh*** (Duman)» dedi. Peyğəmbər: «Sus, həddi aşma» dedi. Bu sözlərdən sonra Ömər - *radıyallahu anhu* – dedi: «Ya Rəsulullah! İzn ver onu öldürüm». Peyğəmbər: «Əgər fikirləşməkdə olduğun (Dəccəl) bu uşaqdırsa sən onu öldürməyə əsla müqtədir olmayacaqsan. O, Dəccəl deyilsə onu öldürməkdə sənin üçün bir xeyir yoxdur» deyə buyurdu[1196]. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, İbn Səyyad ilə Məkkəyə gedən yolda yol yoldaşı oldum. Bir yerdə qonağladıq. İnsanlar ayrı-ayrı yerlərə dağıldılar. Mən onunla bir yerdə qaldım. Lakin məni onun haqqında eşitdiyim sözlər narahat edirdi. O, əşyalarını gətirib mənim əşyalarımla bərabər qoydu. Mən: «Hava çox istidir, sən əşyalarını o, ağacın altına qoysaydın» dedim. Həmən dediyimi yerinə yetirdi. Bu vaxt yanımızdan bir qoyun sürüsü keçirdi. İbn Səyyad gedib bir bardah dolusu süd gətirdi və: «Ya Səid! İç» dedi. Mən: «Hava çox istidir, südə çox istidi» dedim. Südü içməməyimə səbəb yalnız onun əlindən bir şey almamağıma görə idi. O: «Ya Səid! İnsanların bəziləri mənim Dəccəl olduğumu iddia edirlər. Sən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in hədislərini ən yaxşı bilən birisisən» dedi. Məgər sən Peyğəmbərin: «Dəccəlin uşağı yoxdur» dediyini eşitmədinmi? dedi. Mən: «Bəli, eşitdim» dedim. O: «Dəccəl Mədinəyə və Məkkəyə girməyəcəkdir» dedi. Mən isə Mədinə doğuldum və indi də Məkkəyə getmək istəyirəm. (Başqa rəvayətdə: «Peyğəmbər: «Şübhəsiz ki, Allah Dəccələ Məkkəni haram etmişdir» deyə buyurmuşdu. Halbuki mən həcc etmişəm»). Ey Məhəmmədin səhabəsi! Allahın Peyğəmbəri: «O, (Dəccəl) bir Yəhudidir (Başqa rəvayətdə: «O, kafirdir»)» deyə buyurmamışdı. Halbuki mən müsəlman olmuşam. Lakin Vallahi mən Dəccəlin nə vaxt və harada doğulduğunu və indi harada olduğunu çox yaxşı bilirəm. Mən onun atasını da, anasını da tanıyıram. Bir nəfər: «Sənin o, adam (Dəccəl) olmağın səni sevindirərdimi?». O: «Əgər onun pis sifətləri məndə olsaydı mən onları pis qəbul etməzdim» dedi. İbn Səyyadın bu sözlərindən sonra mənim zehnim qarışdı və bu sözləri məndə şübhə doğurdu[1197]. Məhəmməd b. Munkər deyir ki, Cabir b. Abdullah - *radıyallahu anhu* – nu gördüm ki, o İbn Səyyadın Dəccal olduğunu Allaha and içərək söylədi. Mən də: «Sən Allaha and içirsən» dedim. O: «Mən Ömər - *radıyallahu anhu* – dan eşitdim ki, o Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanında İbn Səyyadın Dəccəl olduğuna and içmiş Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – də onun bu andını rədd etməmişdir»[1198]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onu sorğu-sual etdikdən sonra ona bir şey etmədi. Çünki onun Dəccəl olduğuna dair ona bir vəhy gəlməmişdir. Ayrıca Ömər - *radıyallahu anhu* – onun

---

[1196] Müslim 2924,2925.
[1197] Müslim 2926.2927.
[1198] Müslim 2929.

Dəccəl olduğuna dair Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanında and içmiş Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bunu rədd etməmişdir.

***İbn Səyyad Məsih Dəccəldirmi?*** Səhabələrdən İbn Ömər, Cabir, Əbu Zərr və s. Onun Dəccəl olduğuna kəsin qərar vermişlər. Nəfi deyir ki, İbn Ömər - *radıyallahu anhu* – dedi: "Vallahi, İbn Səyyadın Dəccal olmasında şübhəm yoxdur"[1199]. Zeyd b. Vəhb deyir ki, Əbu Zərr - *radıyallahu anhu* – dedi: "İbn Saidin Dəccəl olmasına on dəfə and içməyim, olmadığına bir dəfə and içməyimdən daha xoşdur"[1200]. İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir ki: "Alimlər deyirlər ki: "İbn Səyyadın qissəsi qarışıqdır. O, həqiqətən Dəccəldir, yoxsa başqasımı? Lakin onun dəccallardan bir Dəccal olduğunda şübhə yoxdur". Yenə alimlər deyirlər ki: "Hədislərin zahirində görsənən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə onun Məsih Dəccəl və qeyrisi olduğu haqqında bir vəhiy gəlməmişdir. Ona yalnız Dəccəlin sifətləri vəhiy olunmuşdur. İbn Səyyad üzərində də bu sifətlər vardı. Buna görə də Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onun Dəccal və ya qeyrisi olduğunu qəti olaraq söyləmirdi. Necə ki, Ömər - *radıyallahu anhu* – ya: "Əgər o, Dəccəl olarsa sənin onu öldürməyə gücün çatmaz" deyə buyurmuşdu.

**3. *İsa – Əleyhissəlam – In Zühru Barədə Nazil Olan Ayələr: «O vaxt Allah dedi: "Ey İsa! Mən sənin həyatına son qoyub Özümə tərəf qaldıracağam, səni kafirlərdən təmizləyəcək və sənin ardınca gedənləri Qiyamət gününə qədər kafirlərdən üstün edəcəyəm. Sonra sizin dönüşünüz Mənə olacaq. Mən də ixtilafa düşdüyünüz şeylər barəsində sizin aranızda hökm verəcəyəm».*** *(Ali İmran 55). «(Onların lənətə düçar olmalarının bir səbəbi də)* ***Biz Allahın elçisi Məryəm oğlu əl-Məsihi öldürdük – demələridir. Halbuki onları İsanı nə öldürdülər, nə də çarmıxa çəkdilər. Onlarda yalnız belə bir təsəvvür yarandı. Bu haqlı ixtilafda onlar onun*** *(şəxsən öldürülməsi)* ***barəsində əlbəttə şəkk-şübhə içərisindədirlər. Onların buna dair heç bir məlumatı yoxdur. Onlar ancaq zənnə qapanırlar. Həqiqətdə onu*** *(İsanı)* ***öldürməmişlər. Xeyr, Allah onu Öz dərgahına qaldırmışdır. Şübhəsiz ki, Allah yenilməz qüvvət sahibi, hikmət sahibidir».*** *(ən-Nisa 157-158).* Allah onun öldürülməsini inkar etməklə səmaya yüksəldiyini göstərir. Bu ayə Məsih İsa – *əleyhissəlam* – ın diri olduğu halda səmaya qaldırılmasına aid qəti dəlildir. Şübhəsiz ki, bu baxış haqq olan bir baxışdır. Yəhudilərin İsa – *əleyhissəlam* – ın öldürüb xaça çəkilmələrini və savadsız Xristianların, Yəhudilərin bu dediklərini qəbul edənlərin iddialarının batil olduğunu göstərən ayələrin daşıdığı məqsəd bundadır. Beləliklə İsa – *əleyhissəlam* – ın varlığını, Allah dərgahında olduğunu və Qiyamət günündən öncə yer üzünə gələcəyini bildirməkdir[1201]. İbn Abbas - *radıyallahu anhu* – tərəfindən rəvayət edilən mərfu hədisdə: ***«Şübhəsiz ki,*** *(İsanın zühuru)* ***qiyamət saatı haqda bir bilgidir…».*** *(əz-Zuxruf 61).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yəni Qiyamət günündən öncə Məryam oğlu İsanın zühur etməsi…»[1202]. Mücahid – *rahmətullahi aleyhi* – deyir ki: «İsa – *əleyhissəlam* – ın Qiyamət üçün əlamət olması və Qiyamət günündən əvvəl gəlməsi zühur edəcəyini bildirir".

Matar əl-Varrak – *rahmətullahi aleyhi* – deyir ki: "***O vaxt Allah dedi: "Ey İsa! Mən sənin həyatına son qoyub Özümə tərəf qaldıracağam"*** – bu vəfat etmək

---

[1199] Müslim "Fitən" 18/57,58, Ebu Davud 11/483, Fəthul Bəri 13/325.
[1200] Musnəd 5/148.
[1201] İbn Kəsir 1/577.
[1202] Əhməd, Həkim.

bildiyimiz ölüm deyildir. Eyni şəkildə İbn Cureyc – *rahmətullahi aleyhi* – deyir ki: "Allahın İsa – *əleyhissəlam* – ı vəfat etdirməsi, onu öz dərgahına qaldırmasıdır". Şovkani – *rahmətullahi aleyhi* – deyir ki: "Burada vəfat kəliməsi ilə qəsd edilən yuxudur"[1203]. ***"Sizi gecələr yuxuya daldıran** (bu minvalla sizi bir növ ölüm halına salıb hiss-həyacandan məhrum edən)**, gündüz isə nə etdiyinizi** (nə qazandığınızı) **bilən Odur. Sonra O sizi gündüz** (yuxudan) **oyandırır ki, müəyyən olunmuş vaxt** (əcəl) **gəlib yetişsin. Sonra onun hüzuruna qayıdacaqsınız və sonra da O sizə etdiyiniz əməllər barəsində xəbər verəcəkdir".** (əl-Ənam 60). **"Allah** (əcəli çatan kimsələrin) **canlarını** (ruhlarını) **onlar öldüyü zaman, ölməyənlərin** (hələ əcəli çatmayanların) **canlarını isə yuxuda alar** (çünki yuxu da ölüm kimi bir şeydir, yuxu zamanı ruh bədəni tərk edər). **Ölümünə hökm olunmuş kimsələrin canlarını** (ruhlar aləmində) **saxlayar** (onların ruhu bir daha bədənlərinə qayıtmaz, beləliklə də bədən ölüb gedər). **Digər** (ölümünə hökm olunmamış) **kimsələrin canlarını isə müəyyən bir müddətədək** (əcəlləri gəlib çatıncaya qədər yuxudan oyandıqda bədənlərinə) **qaytarar. Həqiqətən, bunda düşünən bir qövm üçün** (Allahın hər şeyə qadir olmasına, Qiyamət günü ölüləri dirildəcəyinə dəlalət edən) **əlamətlər vardır!".** (əz-Zumər 42).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "(Yuxudan oyandıqda) Həmd bizi öldürdükdən sonra təkrar diriləndən Allahadır. Qayıdış da Onadır"[1204] Həsən - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Yəhudilərə buyurdu: "Heç şübhəsiz ki, İsa – *əleyhissəlam* – ölmədi. O, Qiyamət günündən öncə sizə gələcəkdir"[1205]. İbn Əbu Hatim, Əhməd b. Sinan, Əbu Muaviyə, əl-Aməş, Minhal b. Amr, Said b. Cubeyr, İbn Abbas – *Allah onlardan razı olsun* - rəvayət edir ki: "Allah İsa – *əleyhissəlam* – ı səmaya yüksəltməyi dilədiyi zaman İsa – *əleyhissəlam* – həvarilərinin yanına çıxdı. Evdə Həvarilərdən **12** kişi vardı. Onların yanına çıxdığı zaman başından su damcılayırdı. O: "İçinzdən mənə iman etdikdən sonra **12** dəfə inkar edən vardır. Hansınız mənə oxşadılıb yerimə öldürüləcək və mənimlə eyni dərəcədə olmaq istər? (Başqa rəvayətdə: Cənnətdə yoldaşım olmaq istər[1206])". Yaşca kiçik olan cavanlardan bir gənc (Sərcis) qalxdı və Ona: "Otur" dedi. Sonra onlara dönüb təkrar etdi, yenə o, gənc qalxdı və Ona: "Otur" dedi. Sonra təkrar onlara dönüb təkrar edincə o, gənc yenə: "Mən" dedi. Bundan sonra: "Bəli, o sən olacaqsan" dedi. O, İsa – *əleyhissəlam* – a oxşadıldı, İsa – *əleyhissəlam* – evin pəncərəsindən səmaya yüksəldilir. Yəhudilər girib bənzərini götürdülər, onu öldürdülər və asdılar. İçlərindən biri ona iman etdikdən sonra **12** dəfə küfr etdi"[1207].

***«Onlar** (İsaya inanmayanlar) **hiyləyə əl atdılar. Allah da onların hiyləsinə qarşı əvəz verdi. Allah bütün hiyləgərlərdən tədbirlidir** (hiyləgərlərə ən yaxşı cəza verəndir)**».** (Ali İmran 54).* Bu ayə Yəhudilərin İsa – *əleyhissəlam* – ı öldürmək istədikləri üzərinə nazil olmuşdur. Xain Yahuza adında biri İsa – *əleyhissəlam* – ı öldürmək üçün onu təqib edənlərlə birlikdə (İsa – *əleyhissəlam* – ın) olduğu yerə gəlir. Lakin Allah - *subhənəhu və təalə* - İsa – *əleyhissəlam* – ı səmaya yüksəldir. Xain Yahuzanı isə İsa – *əleyhissəlam* – a bənzədir. Xain Yahuza evi axtarıb İsa – *əleyhissəlam* – ı orada tapmadıqda çölə çıxır. Onunla gələnlər Yahuzanın İsa –

---

1203 "Fəthul Qadir" 1/344.
1204 Buxari 6325, 7395.
1205 İbn Kəsir "Təfsir" 1/366, Mursəl (Tabiin Səhabənin adını zikr etmədən bir başa Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən rəvayət edir) hədis.
1206 İbn Cərir ət-Təbəri 9/372.
1207 İbn Kəsir "Təfsir" 1/575.

*əleyhissəlam* – olduğunu görüb bu inancla onu öldürürlər[1208]. İbn Cərir, Mücahid – *rahmətullahi aleyhi* – dan rəvayət edir ki: "Onlar İsa – *əleyhissəlam* – a bənzəyən birini asdılar. İsa – *əleyhissəlam* – isə diri olaraq səmaya qaldırıldı".

Bu ayələr İsa – *əleyhissəlam* – ın diri olmasının və Qiyamət əlamətlərindən biri olmasının dəlilidir. Məryəm oğlu İsa – *əleyhissəlam* – ın Şamda ağ minarəli (məscidin) üzərinə iki mələyin qanadında enməsi, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in şəriəti və hökmləri ilə əmr etməsi, donuzları və xaçları məhv etməsi, Dəccəli öldürüb yer üzündə İslam ilə hökm etməsi. ***«Kitab əhlindən elə bir kəs olmaz ki, ölümündən əvvəl ona** (İsaya) **iman gətirməsin, lakin o Qiyamət günündə onların əleyhinə şəhadət verəcəkdir».*** *(ən-Nisa 159).* İbn Abbas - *radıyallahu anhu* – ayə haqqında deyir ki: ***"Kitab əhlindən elə bir kəs olmaz ki, ölümündən əvvəl ona** (İsaya) **iman gətirməsin"***: Məryəm oğlu İsa – *əleyhissəlam* – ın ölümündən öncə" deməkdir[1209]. Əbu Malik – *rahmətullahi aleyhi* – deyir ki: ***"Kitab əhlindən elə bir kəs olmaz ki, ölümündən əvvəl ona** (İsaya) **iman gətirməsin"*****:** Bu İsa – *əleyhissəlam* – ın nüzulundan sonra olacaqdır. Məryəm b. Isa – *əleyhissəlam* – ölmədən öncə Əhli Kitabdan hər biri mütləq ona iman gətirəcəkdir" dedi. İbn Cərir – *rahmətullahi aleyhi* – deyir ki: "Bu görüşlər içində doğru olanı birinci örüşdür: İsa – *əleyhissəlam* – ın nüzulundan sonra Əhli Kitabdan, İsa – *əleyhissəlam* – ın ölümündən öncə ona iman etməyən kimsə qalmayacaqdır" deyənləri görüşüdür[1210].

***"O,** (həm) **beşikdə ikən,** (həm də) **yaşa dolduqdan sonra insanlarla danışacaq və salehlərdən** (xeyirli iş görən şəxslərdən) **olacaqdır".*** *(Ali İmran 46).* ***"**(Ya Rəsulum!) **Xatırla ki, o gün** (Qiyamət günü) **Allah** (İsaya) **belə buyuracaq: "Ya Məryəm oğlu İsa! Sənə və anana nemətimi yadına sal. O zaman səni müqəddəs ruhla qüvvətləndirmişdim. Sən beşikdə olanda da, yetkin çağında da adamlarla danışırdın...".*** ***(Məryəm 110).*** İbn Zeyd – *rahmətullahi aleyhi* – birinci ayənin təfsirində deyir ki: "***Sən beşikdə olanda da, yetkin çağında da adamlarla danışırdın..."*** İsa – *əleyhissəlam* – onlarla beşikdə ikən danışmışdır və Dəccəli öldürdükdən sonra cavan ikən onlarla danışacaqdır"[1211]. Sələbi – *rahmətullahi aleyhi* – deyir ki: "***Yetkin çağında da"*** İsa – *əleyhissəlam* – yer üzünə yetkin olaraq enəcəkdir". İbn Cərir – *rahmətullahi aleyhi* – deyir ki: "Bu nəql etdiklərimiz bütün təfsir əhlinin görüşüdür. Ayəni hamısı belə təfsir etmişlər"[1212].

***"Şübhəsiz ki, o,** (İsanın zühuru) **Qiyamət saatı üçün bir əlamətdir. Ona** (Qiyamətə) **şəkk etməyin və Mənə tabe olun. Bu, doğru yoldur!".*** *(əz-Zuhruf 61).* İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: ***"Şübhəsiz ki, o,** (İsanın zühuru) **Qiyamət saatı üçün bir əlamətdir"*** ayəsi haqqında: Məryəm oğlu İsa – *əleyhissəlam* – Qiyamət günündən öncə nüzul edər"[1213].

***İsa – Əleyhissəlam – In Zühru Barədə Nazil Olan Hədislər:*** Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həyatım əlində olan Allaha and olsun ki, Məryəm oğlu İsa – *əleyhissəlam* – adil bir hakim olaraq sizin içinizə enməsi yaxındır. O, xaçları sındıracaq, donuzları öldürəcək və cizyəni qaldıracaqdır. Mal gələcək lakin (elə bir şəkildə artacaq ki) heç kimsə qəbul

---

[1208] İbn Kəsr 11/37 heç bir qaynaq zikr etmədən göstərir.
[1209] "Cəmiul Bəyan" 9/380, "Fəthul Bəri" 6/492.
[1210] "Cəmiul Bəyan" 6/386, "Fəthul Bəri" 6/492.
[1211] "Cəmiul Bəyan" 6/420.
[1212] İbn Kəsir 1/214, Ruhul Məani 4/179, Zadul Məsir 1/392, Zəməhşəri "Kəşşaf" 1/192.
[1213] İbn Hibban 8/288, İbn Kəsir 4/132.

etməyəcəkdir. Nəhayət bir səcdə dünya və dünyadakı şeylərdən xeyirli olacaqdır»[1214]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Görün siz necə (bir ümmətsinizki) rəhbəriniz özünüzdən olduğu bir halda Məryəm oğlu İsa – *əleyhissəlam* – sizlərə nazil olacaqdır (İmamınız sizdən olduğu halda Məryəm oğlu aranıza nüzul etdikdə halınız necə olacaqdır?)» [1215]. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Sübh çağı imam onlarla birlikdə namaza durduğu bir vaxtda Məryəm oğlu İsa – *əleyhissəlıam* – gələcəkdir. Bu imam geri çəkilib yerini ona vermək istədikdə İsa – *əleyhissəlam* – əlini onun çiyninə qoyub deyəcəkdir: «Keç yerinə namazı qıldır». İmam irəli keçib namazı qıldıracaqdır. Sonra İsa – *əleyhissəlam* – Qüdsə gedəcəkdir. Orada Ludd qapsının[1216] yaxınlığında Dəccəli yaxalayıb öldürəcəkdir. Dəccəl onu gördükdə duz suda əridiyi kimi əriyəcəkdir»[1217]. Cabir b. Abdullah - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Ümmətimdən bir qrup haqq uğrunda müzəffər şəkildə mübarizəni Qiyamət gününə qədər davam edər. Məryəm oğlu İsa – *əleyhissəlam* – yerə enəcək. Başçıları Mehdi ona: «Gəl bizə namazda imamlıq et!» deyəcəkdir. İsa: «Xeyr, onlar bir-birilərinin imamıdır. Bu da Allahın bu ümmətə olan ehtiramıdır» deyə cavab verər[1218]. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Peyğəmbərlər ata bir qardaşdılar. Anaları ayrıdır. Dinləri isə birdir. Mən Məryəm oğlu İsa – *əleyhissəlam* – a ən yaxın olanam. Çünki mənimlə onun arasında Peyğəmbər yoxdur»[1219]. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «İsra gecəsində Musa – *əleyhissəlam* – ilə qarşılaşdım. O, uzun boylu və düz saçlı olduğunu gördüm. Şerve qəbiləsinin adamlarına bənzəyirdi. İsa – *əleyhissəlam* – ilə də qarşılaşdım (Başqa rəvayətdə: «Mən yuxumda Kəbənin yanında bir adam göstərildi. Bir də baxdım ki, gördüyüm əsmər (qarabuğdayı) kimsələr içərisində ən gözəlidir. Saçları dümdüz (telləri) çiyinlərinə qədər uzanmışdı. Başından su damcılayırdı. Əllərini iki kişinin çiyinlərinə dayamış halda beyti təvaf edirdi. Kim bu? Deyə soruşdum Mənə: «Məryəm oğlu Məsihdir (Başqa rəvayətdə: «İsa – *əleyhissəlam* – ı da gördüm. Ona ən çox bənzəyən Urva b. Məsud idi. İbrahimi də gördüm. Ona ən çox bənzəyən qardaşınızdır (özünü qəsd edir). Cəbraili də gördüm Ona ən çox bənzəyən Dihyə b. Xəlifətil əl-Kəlbidir») dedilər. Onun arxa tərəfində saçı qısa, qıvrım, sağ gözü kor birini də gördüm. Gözü su üzərindəki üzüm dənəsi kimi pırtlağdı. İbn Katana bənzəyirdi. Əllərinin birinin (iki nəfərin) çiyninə dayamış halda beyti təvaf edirdi. Kim bu? Deyə soruşdum. Mən: «Məsih Dəccəşldir» deyə cavab verdilər)[1220]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Nəfsim əlində olana and olsun ki, Məryəm oğlu Həcc və ümrəsini edərkən və ya hər ikisini edərkən Rahva (iki dağ arasında yol) təlbiyə edəcəkdir"[1221]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «İsa b. Məryəm enər, donuzları öldürər, xaçı sındırar, namaz için ətrafında toplanırlar, mal verir qəbul

---

[1214] Buxari 4/414, 5/121, 6/490, Müslim "İman" 155 (242), Əbu Davud 4324, Tirmizi 2234.
[1215] Buxari 6/491, Müslim 2/193, Əhməd 2/336, İbn Hibban 8/284.
[1216] Fələstinin Rəmlə şəhərinin yaxınlığında.
[1217] İbn Məcə, İbn Huzeymə, əl-Albani «Səhihul Cəmi» 7752.
[1218] İbn Qeyyim «Mənar əl-Munif» 147,148, Süyuti «əl-Havi fil Fətava» 2/64. Buxari 6/491, Müslim "İman" 247, 2/193,194.
[1219] Buxari «Ənbiya» 48, Əhməd 2/437, Təbəri «Cəmiul Bəyan» 4/22,23,
[1220] Buxari «Ənbiya» 48, 6/477, 13/90, Müslim «İman» 272.
[1221] Müslim 1252, Əhməd 2/240,272,540.

edilməz, cizyəni qaldırır, Həcc və Ümrə üçün və ya hər ikisi üçün Rahvaya enər”[1222]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mən Məryəm oğlu İsa – *əleyhissəlam* – a insanların ən yaxınıyam. Peyğəmbərlər anaları ayrı, ataları bir qardaşdılar. (Başqa rəvayətdə: Doğulan elə bir uşaq yoxdur ki, şeytan ona toxunmuş olmasın. Elə şeytanın toxunmasındandır ki, uşaq doğulduqda fəryad edərək ağlayır. Şeytanın bu toxunmasından Məryəm oğlu İsa – *əleyhissəlam* – ilə anası müstəsnadır: ***«Məryəmi və onun nəslini məlum şeytandan Sənə tapşırıram».*** *(Ali İmran 36)*[1223]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Peyğəmbərlər anaları ayrı, ataları bir qardaşdılar. Mən Məryəm oğlu İsa – *əleyhissəlam* – a insanların ən yaxınıyam. Çünki mənimlə onun arasında Peyğəmbər yoxdur. O, enəcəkdir. Onu gördükdə (bu vəsflərlə) tanıyacaqsınız: Ağ və qırmızıya çalan rəngdədir. Əynində xəfif sarı rəngdə iki libas vardır. Yaşlı olmasa da belə başından su damcılar. Xaçı sındırar, donuzları öldürər, cizyəni qaldırar, insanları İslama dəvət edər. Onun zamanında Uca Allah İslamdan başqa bütün dinləri qaldıracaq və onun zamanında Məsih Dəccəli öldürəcəkdir. Sonra yer üzünə əmanət enəcəkdir. Aslanlar dəvələrlə, pələnglər inəklərlə, canavarlar qoyunlarla birlikdə yeyəcək (otlayacaq), uşaqlar ilanlarla oynayacaq onlara zərər verməyəcəkdir. İsa – *əleyhissəlam* – **40** il qalacaqdır, sonra vəfat edəcəkdir, müsəlmanlar da onun cənazəsini qılacaqlar”[1224]. İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Meraca çıxdığım gecə İbrahim, Musa və İsa – *əleyhimussəlam* – ilə görüşdüm. Qyamət haqqında danışırdılar. İbrahim – *əleyhissəlam* – söz verdilər. O: “Bu barədə məndə elm yoxdur” deyib sözü Musa – *əleyhissəlam* – a verdilər o: “Bu barədə məndə elm yoxdur” deyə cavab verdi. Nəhayət İsa – *əleyhissəlam* – a yönəldilər və ondan cavab gözlədilər, o da: “Onun vaxtına gəlincə onu Allhdan başqa kimsə bilməz. Rəbbimin mənə verdiyi söz, heç şübhəsiz ki, Dəccəl çıxacaqdır. Mənim əlimdə iki qılınc olacaqdır. Məni gördükdə qurğuşunun əridiyi kimi əriyəcəkdir. Məni gördükdə Allah onu həlak edəcəkdir. O, qədər ki, daş və ağac: “Ey müsəlman! Mənim arxamda bir kafir var, gəl və onu öldür” deyəcəkdir və Allah onları həlak edəcəkdir. Sonra insanlar öz ölkələrinə dönəcəklər. Bu anda Yəcuc və Məcuc çıxacaqdır. Onlar yüksək yerlərdən sürətlə enəcəklər və onların məmləkətlərini dağıdacaqlar. Qarşılarına nə çıxarsa həlak edərlər, çatdıqları hər suyu içəcəklər. Sonra insanlar onlardan şikayət üçün mənim yanıma gələcəklər və mən də onların əleyhinə Allaha dua edəcəyəm. Allah onları həlak edəcəkdir. Yer üzü onların pis qoxuları ilə qoxacaqdır. Uca Allah bir yağış endirəcək və onların cəsədlərini sürükləyib dənizə atacaqdır. Rəbbimin mənə verdiyi söz belədir: Bütün bunlar Qiyamət günü doğuşunu gözləyən hamilə bir qadın kimi qısa zaman içində baş verəcəkdir”[1225]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Müsəlmanların üç məmləkəti olacaq: İki dənizin birləşdiyi yerdə olan məkan, Hirədə bir məmləkət, Şamda da bir məmləkət. İnsanlar üç dəfə qorxacaqlar. Dəccəl şərq tərəfdən çıxaraq gələcəkdir. Onun ilk olaraq girəcəyi məmləkət iki dənizin birləşdiyi yerdə olacaqdır. O, məmləkətin xalqı üç qrup olacaqdır. Bir qrup: “Qalxın, imtahan edilirik. Baxaq görək kimdir bu?” deyəcəklər. Bir qrup: “Bədəvilərə

[1222] Əhməd 2/290, 7890, İbn Cərir 6/458.
[1223] Müslim 2366.
[1224] Əhməd 9259, Əbu Davud 4/117, Həkim 2/595, İbn Hibban 8/277, İbn Cərir 9/388.
[1225] Əhməd 1/375, İbn Məcə 4081, Həkim 2/384.

qatılacaqdır”. Üçüncü qrup: “Onlardan sonra olan məmləkətə pənah aparacaqlar”. Dəccəlin yanında əyinlərində yaşıl taylasan olan **70** min adam olacaqdır. Yanındakıların çoxu Yəhudi və qadınlar olacaqdır. Sonra digər məmləkətə gələcəkdir. Müsəlmanlar Əfik boğazına enəcəklər və özlərinə aid bir sürünə də azad edəcəklər (buraxacaqlar). Sürülər ələ keçiriləcək. Şiddətli bir aclığa və ağrıya düşəcəklər. O, qədər ki, onlardan biri oxunun taxtasını bişirib yeyəcəklər. Onlar bu halda olduqları vaxt bir carçı çıxıb: “Ey insanlar! Sizə kömək gəldi!” deyə üç dəfə nida edəcəkdir. Bir qism digərinə: “Heç şübhəsiz ki, bu tox adamın səsidir” deyəcəkdir. Məryəm oğlu İsa – *əleyhissəlam* – səhər namazı vaxtı enəcək və onların əmirləri İsa: “Ey Allahın Rəsulu! Önə keç, namaz qıldır” deyəcək o da: “Bu ümmət bir-birilərinə əmir edilmişdir” deyəcək və əmirləri önə keçib namaz qıldıracaq. Namazı bitirdikdə İsa – *əleyhissəlam* – qısa nizəni alıb Dəccələ doğru gedəcək, Dəccəl onu gördükdə qurğuşun əridiyi kimi əriyəcək və İsa – *əleyhissəlam* – nizəni onun sinəsinə salaraq öldürəcəkdir. Ətrafındakılar da məğlubiyyətə uğrayacaqlar. O, gün onlardan heç birini gizləyəcək bir şey tapılmayacaq. Hətta ağac belə: “Ey mömin! Kafir buradadır” daş belə: “Ey mömin! Kafir buradadır” deyəcəkdir”[1226]. Yaqub b. Asim b. Urvə b. Məsud əs-Səqafi rəvayət edir ki, Abdullah b. Amr - *radıyallahu anhu* – dan eşitdim ki, bir nəfər onun yanına gələrək: “Qiyamət belə belə şəkildə qopacaq deyə bəhs etdiyin hədis hansıdır?” deyə soruşdu. Abdulah: “***Sübhənəllah!*** – və ya ***Lə İləhə İlləllah!*** Sonra da: “Heç kimsəyə heç bir hədis danışmamağı düşündüm. Mən ancaq bunu söylədim: “Mütləq sizlər az zaman sonra evləri yandıran filan və filan böyük bir iş görəcəksən”. Sonra Abdullah b. Amr - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: “Ümmətim içində Dəccəl çıxıb **40** qalacaqdır. **40** gün, **40** ay, **40** il mi qalacaq bilmirəm. Uca Allah Məryəm oğlu İsa – *əleyhissəlam* – ı göndərəcək. O, Urvə b. Məsud kimidir. Dəccəlin izinə düşüb onu öldürəcəkdir. Sonra insanlar iki nəfər arasında heç bir düşmənlik olmadan **7** il keçirəcəklər. Bundan sonra Uca Allah, Şam tərəfdən soyuq bir külək göndərəcək. Bu külək yer üzündə qəlbində zərrə qədər bir xeyir və ya iman olan heç kimsəni buraxmayıb ruhunu alacaqdır. Belə ki, sizdən biri bir dağın ortasına girsə də belə külək oraya girib onun ruhunu alacaqdır”. Sonra: “İnsanların pisləri vəhşi heyvanlar kimiləri qalacaqdır. Heç bir yaxşılıq bilməyəcək, heç bir pisliyi də pis görməyəcəklər. Şeytan onlara görünərək: “İcabət etmirsinizmi?” deyə səsləyər. Onlar: “Bizə nə əmr edirsən?” deyəcəklər. O, da onlara bütlərə ibadəti əmr edəcəkdir. Onlar beləcə ruziləri bol. Yaşayışları gözəl olacaqdır. Sonra sura üfürüləcək və onu eşidən hər kəs boynunun bir tərəfini əyib digər tərəfini qaldıracaqdır. Onu eşidənlərdən biri dəvələrinin hovuzunu təmir edən birisi olacaqdır. O, və bütün insanlar yıxılacaqlar. Sonra Uca Allah bir narın yağış göndərəcəkdir. Bu yağışdan sonra insanların bədənləri bitəcəkdir. Sonra sura bir dəfə də üfürüləcəkdir simmetrik olaraq qalxacaqlar”. Sonra: “Ey insanlar, Rəbbinizə gəlin” deyiləcəkdir. Sonra: “Onları saxlayın, çünki sorğu-sual olunacaqlar. Atəşə göndərilənləri çıxın. Soruşulacaq: “Nə qədər adam”. Ona: “Hər min nəfərdən doqqu yüz doxsan doqquzu” deyiləcək. Gənclər qocalacaq. O, gün baldır açılacaq” gündür[1227]. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: “Müsəlmanlar Şamda olan Duhan dağına qaçırlar. Dəccəl gəlir və onları mühasirəyə alır. Bu hal şiddətlənir və sıxıntılar artır.

---

[1226] Əhməd 4/216, Hakim 4/478.
[1227] Hakim 4/550.

Sonra Məryəm oğlu İsa – *əleyhissəlam* – nüzul edir…”[1228]. Abdullah b. Salam deyir ki: “Dörd aydın qəbirlər: “Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in qəbiri, Əbu Bəkr və Ömər - *radıyallahu anhum* – nun qəbiri və dördüncü ora dəfn ediləcək İsa – *əleyhissəlam* – ın qəbiridir”[1229]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “İsa - *əleyhissəlam* - endiyi zaman evlənəcək, bir oğlu olacaq, **40** il yaşayıb öləcəkdir və mənim yanımda dəfn olunacaqdır”[1230].

***İsa – Əleyhissəlam – In Zühru Barədə Alimlərin Sözləri:*** İmam Təhavi – *rahmətullahi aleyhi* - deyir ki: “Biz əyri gözlü Dəccəlin çıxmasına və İsa - *əleyhissəlam* - ın göydən zühur edəcəyinə iman edirik”[1231]. İbnul Covzi, Abdus b. Malik Əbi Muhəmməd əl-Attardan rəvayət edir ki: “Əbu Abdullah Əhməd b. Muhəmməd b. Hənbəl – *rahmətullahi aleyhi* - deyir ki: “Məsih Dəccəlin çıxmasına və iki gözü arasında kafir yazılı olacağına iman etmək lazımdır. Bu haqda hədislər varid olmuşdur. Bunlara iman vacibdir. Məryəm oğlu İsa - *əleyhissəlam* - ın zühur edib onu Lüd qapısında öldürəcəyinə də iman etmək lazımdır”[1232]. İmam Əbu Bəkr əl-Acurri – *rahmətullahi aleyhi* - öz “əş-Şəriə” 380 adlı kitabında: “Məryəm oğlu İsa - *əleyhissəlam* - ın adil bir hakim olaraq zühur etməsi və haqqı iqamə edib Dəccəlı öldürəcəyinə” dair bab açmış və bir çox hədisləri zikr etmişdir.

**4. *Mehdinin Gəlməsi*:** Əsl adı Muhəmməd b. Abdullah olub, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Əhli Beytindəndir. Fatimə - *radıyallahu anhə* – nin nəslindən, Həsən b. Əli - *radıyallahu anhum* – un qolundandır. Zülm və haqsızlıqla dolub daşan yer üzünü ədalətlə dolduracaqdır. Ümmət ondan öncə görmədiyi bolluq və bərəkəti onun zamanında gürür. İbn Kəsir – *rahmətullahi aleyhi* - deyir ki: “Onun zamanında məhsul bol olur, kənd təsərüfatı bərəkətlənər, mal çoxalır, sultan qalib gəlir, din güclü olur. Onun zamanında yaxşılıqlar davamlı olur”[1233]. İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dünyanın sonuna bir gün qalsa belə, Allah o günü uzadacaqdır. O, vaxta qədər ki, Əhli-Beytimdən bir insan çıxacaq. Adı-adıma, atasının adı isə atamın adına oxşayacaqdır. Yer üzü zülm ilə dolduğu zaman, o yer üzünü ədalətlə dolduracaqdır»[1234]. Ummu Sələmə - *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mehdi mənim nəslimdən, Fatimənin kökündəndir»[1235]. İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Əhli Beytimdən adı mənim adımala eyni olan bir nəfər ərəblərə rəhbərlik etməyincə dünyanın sonu gəlməyəcəkdir (Başqa rəvayətdə: Adı mənim adıma, atasının adı atamın adı ilə eyni olan)»[1236]. Sovban - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizin xəzinənizin yanında üç kişi öldürüləcəkdir (Xəzinəniz üçün üçü döyüşür). Bunların üçü də Xəlifə övladlarıdır. Lakin xilafət heç birinə nəsib olmayacaqdır (Heç biri qalib gəlməyəcəkdir). Sonra günçıxan tərfdən qara bayraqlar ortaya çıxacaqdır. Onlar daha öncə heç bir qövmün etmədiyi şəkildə sizinlə vuruşacaqlar. O, qara bayrağın liderini gördükdə qar üstündə

---

[1228] Əhməd 3/367, Məcmuaz Zəvaid 7/344.
[1229] Buxari “Tarixul Kəbir” 1/263, Tirmizi 3617, Fəthul Bəri 7/66 zəif .
[1230] Tirmizi.
[1231] Şərh Təhaviyyə 499.
[1232] İbnul Covzi “Mənakib İmam Əhməd” 171.
[1233] “əl-Fitən vəl-Məlâhim” 1/31.
[1234] Əbu Davud.
[1235] Əbu Davud 11/373, İbn Məcə 2/1368, Tirmizi, əl-Albani «Səhihul Cəmi» 6610.
[1236] Əhməd 5/199, Əbu Davud 11/371, Tirmizi 6/485, əl-Albani 5180.

sürüşməli olsazda belə gedib ona beyət edin. Çünki Allahın xəlifəsi Mehdidir»[1237]. İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: «Mehdi şərq ölkələrindən dəstək görəcəkdir. Şərq ölkələri əhalisi ona kömək edəcək, onun hakimiyyətini dəstəkləyəcəklər. Bayraqları isə qara rəngdə olacaqdır. Bu da əzəmət və vüqar nişanəsidir. Çünki Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in də bayrağı da qara rəngdə idi və ona ***Uqab*** – qartal deyərdilər. Xalid b. Valid - *radıyallahu anhu* – İraqdan gəldikdə o, bayrağı Mədinə yaxınlığındakı təpənin üstünə sancır. Həmən yerin adı da ***Səniyyətul Uqab*** adlanır» [1238]. İbn Kəsir – *rahmətullahi aleyhi* - deyir ki: "Bu hədisdəki xəzinələrdən qəsd Kəbənin xəzinələridir. Xəlifə uşaqlarından üç kişi onu almaq üçün bir-biriləriylə döyüşəcəklər. Axır zaman olduqda isə şərq tərəfdən Mehdi çıxacaqdır. Yoxsa ki, Rafizilərin iddia etdiyi kimi qaranlıq bir mağarada qeyb olub sonra isə peyda olacaqdır yox. Onların bur görüşü boş bir şeytan uydurmasıdır. Nə Quran da, nə də Sünnədə belə bir şey yoxdur..."[1239]. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamətə yaxın ümmətimdə Mehdi zühur edəcəkdir. Allah onun üçün yağış yağdıracaq, yerdən nəbatat çıxacaqdır. O, malı ədalətlə paylayacaqdır. Heyvanlar artacaq, ümmətim güclənəcəkdir. O, yeddi-səkkiz il yaşayacaqdır (Başqa rəvayətdə: «Doqquz il yaşayacaqdır. Ondan sonra həyatda xeyir-bərəkət qalmayacaqdır)»[1240]. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Sizi Mehdi ilə müjdəliyirəm. O, insanlar arasında anlaşmazlıq və zəlzələlər olduğu zaman çıxar. Yer üzü ondan öncə zülm və haqsızlıqla dolu olduğu kimi Onun gəlməsiylə ədalət və doğruluqla dolar. Göydə və yerdə kim varsa Ondan razı olar. İnsanlar arasında mal eyni olaraq paylanılır... Bu hal **7-8** və ya **9** il belə davam edər. Ondan sonra yaşamanın (həyatın) bir xeyri olmaz"[1241]. Əli - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mehdi bizdən – Əhli Beyitdəndir. Allah onu bir gecədə islah edəcəkdir»[1242]. İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: «Allah bir gecənin içində onun tövbəsini qəbul edər, onu müvəffəq edər, ona ilham verər və onu düz yola yönəldər»[1243]. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mehdi məndəndir. Alnı (gicgahına qədər) açıq və qırğıburundu. Yer üzü ondan öncə zülm və haqsızlıqla dolu olduğu kimi o, gəldikdən sonra ədalət və doğruluqla dolub daşar. Yeddi il hökm edər»[1244]. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Məryəm oğlu İsa - *əleyhissəlam* – ın arxasında namaz qılan şəxs bizdəndir»[1245]. Əbu İshaq – *rahmətullahi aleyhi* – deyir ki: "Əli oğlu Həsən - *radıyallahu anhu* – ya baxdı və: "Bu oğlum Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in adlandırdığı kimi seyyidir. Onun nəslindən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in adını daşıyan bir nəfər çıxacaq. Əxlaq tərəfdən

---

[1237] İbn Məcə 1367, Həkim «Mustədrək» 4/463,464, əl-Albâni – *rahmətullahi aleyhi* – deyir ki: "O Allahın xəlifəsi Mehdîdir" sözü xariç səhihdir. "Zəif Hədislər" 1/119-121, H. 85.
[1238] ən-Nihayə» 1/29,30.
[1239] "əl-Fitən vəl-Məlâhim" 1/29-30.
[1240] Həkim «Mustədrək» 4/557,558, İmam Əhməd «Musnəd» 3/37, əl-Albani «Səhih Silsilə» 2/711.
[1241] Musnəd 3/37, Heysəmî "Məcmauz-Zəvâid" 7/313-314.
[1242] Musnəd 2/58, İbn məcə 2/1367, əl-Albani «Səhih Cəmius Səğir» 6611.
[1243] ən-Nihayə 1/29. "əl-Fitən vəl-Məlâhim" 1/29.
[1244] Əbu Davud 4265, əl-Albani «Səhihul Cəmi» 6612.
[1245] Suyuti "Hâvî" 2/64 əl-Albâni "Camius-Sağir" 5/219, H. 5796.

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bənzəyəcək, yaradılış tərəfdən isə bənzəməyəcək. Sonra yer üzünü ədalətlə dolduracaqdır qissəsini danışdı”[1246].

***Buxari Və Müslimdə Mehdiyə İşarə Edilən Hədislər:*** Cabir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: « Ümmətimdən bir qrup haqq uğrunda müzəffər şəkildə mübarizəni Qiyamət gününə qədər davam edər. Məryəm oğlu İsa - *əleyhissəlam* – yerə enəcək. Başçıları Mehdi ona: «Gəl bizə namazda imamlıq et!» deyəcəkdir. İsa: «Xeyr, onlar bir-birilərinin imamıdır. Bu da Allahın bu ümmətə olan ehtiramıdır» deyə cavab verdir[1247]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Görün siz necə (bir ümmətsinizki) rəhbəriniz özünüzdən olduğu bir halda Məryəm oğlu İsa - *əleyhissəlam* – sizlərə nazil olacaqdır (İmamınız sizdən olduğu halda Məryəm oğlu aranıza nüzul etdikdə halınız necə olacaqdır?)»[1248]. Cabir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamətə yaxın ümmətimin axırında saysız (saymadan) mal paylayan xəlifə olacaqdır»[1249]. Hədisin ravilərindən olan Cəriri belə deyir: «Əbu Nədra və Əbul Əlaya – sizcə bu Ömər b. AbdulƏzizdirmi? – deyə müraciyət etdim. Onlar da: «Xeyr» deyə cavab verdilər[1250]. Mehdi hədislərini inkar edənlər deyirlər ki, Mehdi elə İsa – *əleyhissəlam* – ın özüdür və buna dəlil olaraq: Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Fitnə-fəsad yayılacaq, dünyanın sonu yaxınlaşacaq, insanlarda paxıllıq və xəsislik çoxalacaq, qiyamət yalnız pis insanlara görə qopacaqdır. Mehdi isə elə Məryəm oğlu İsadır»[1251]. Bu hədis zəifdir. Çünki Muhəmməd b. Xalid əl-Cundi haqqında Zəhəbi – *rahmətullahi aleyhi* – deyir ki: “Ezdi diyir ki: “Hədisi qəbul edilməz. Hakim – *rahmətullahi aleyhi* – deyir ki: “Bilinmir kimdir”. Mən deyirəm ki: “Mehdi isə elə Məryəm oğlu İsadır” hədisi munkərdir[1252]. İbn Teymiyyə, İbn Həcər – *rahmətullahi aleyhi* – deyirlər ki: “Bilinmir kimdir”[1253].

***Mehdi Hədislərinin Mutəvatir Olması:*** Əbul Həsən əl-Arabi – *rahmətullahi aleyhi* – deyir ki: “Mehdi barəsində Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən gələn hədislər mutəvatir olmasıdır...” [1254]. Şövkani – *rahmətullahi aleyhi* – deyir ki: “Mehdinin gəlməsini Mutəvatir olduğunu **50** hədislə açıqlamaq yetərlidir. Bu hədislərin mutəvatir olmasını bütün üsul qaydaları qəbul etmişlər...”[1255]. Sıddıq Həsən Xan – *rahmətullahi aleyhi* – deyir ki: “Mehdi barəsində hədislər fərqli olsa da həqiqətən çoxdur və mutəvatir dərəcəsindədir. Bu hədislər Sünən, Mucə və Musnədlərdə vardır”[1256].

***Mehdi Hədislərini İnkar Edənlər Və Onlara Cavab:*** Lakin son zamanlarda törəyən yazarlardan bəziləri (“Rəşid Rıza “Mənâr Tefsiri” 9/499-504, Əhmed Əmin “Duhal-İslam” 3/237-241) Mehdinin gəlməsini inkar etməklə, onunla bağlı hədislərin zəif və batil olduğunu və Mehdini sadəcə Rafizilərin uydurduqları bir şey olduğunu və

---

[1246] Əbu Davud 4290.
[1247] İbn Qeyyim «Mənar əl-Munif» 147,148, Süyuti «əl-Havi fil Fətava» 2/64. Buxari 6/491, Müslim 2/193,194.
[1248] Buxari 6/491, «Ənbiya» 49, Müslim 2/193.
[1249] Müslim 18/38,39.
[1250] Nəvəvi Şərhi, Müslim “Fitən” 18/38,39, Bəgavi “Şərhus-Sünnə”, Mehdî 15/86,87.
[1251] İbn Məcə 2/1340, Həkim «Mustədrək» 4/441,442, zəif hədis.
[1252] “Mizanul-İtidâl” 3/535.
[1253] “Minhacus-Sünnə” 4/211, “Takribut-Təhzîb” 4/157.
[1254] Təhzibul-Kəmal” 3/1194, “əl-Mənârul-Munîf” s:142, “Fəthul Bəri” 6/493,494.
[1255] “ət-Təvzîh”, “əl-İzâa” s:113,114.
[1256] “əl-İzâa” s:112.

sonradan Əhli Sünnənin kitablarına qarışdığını söyləmişlər. Bu yazarlar Tarixçi İbn Haldunun məşhur "Muqəddiməsində" Mehdi hədislərini zəif etməsindən faydalanmışlıar. Belə ki, İbn Haldun bu sahədə geniş elm sahibi deyildi ki, hədislərə zəif və səhih desin. Bütün bunlara AbdulMuhsin əl-Abbad – *hafizahullah* - "***Mehdî Hakkında Gələn Sahih Hədisləri Yalanlayanlara Cavap***"adlı kitabında geniş olarak cavab vermişdir. Allah ondan razı olsun. Həmçinin Əhməd Şakir "Şərh Musnəd Əhməd" 5/197-198 cavab vermişdir.

İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "İmamilərə görə Mehdi, Həsən - *radıyallahu anhu* – nun deyil, Hüseyn - *radıyallahu anhu* – nun övladlarından olan Muhəmməd b. Həsən əl-Əsakir əl-Muntazadır. Musa - *əleyhissəlam* - ın əsasına sahib olub, **500** yüz ilə qədər öncə Samirədəki mağaraya girib ondan sonra onu görən olmamışdır. Buna görə də Rafizilər hərgün onu gözləyərlər və bu mağaranın qapısında bir atla durub yanlarına çıxması üçün: Ya Mövlana çıx, Ya Mövlana çıx" deyərlər. Sonra da pərişan və ümüdsüz olaraq geri dönərlər. Bu da onların halı"[1257].

**5. *Yəcuc Və Məcuc Tayfasının Çıxması: Zülqərneyn dedi: «Bu Rəbbimdən bəxş edilən bir mərhəmətdir. Rəbbimin təyin etdiyi vaxt*** *(Qiyamətə yaxın Yəcuc-Məcuc tayfalarının dünyanı bürüyəcəyi zaman)* ***gəldikdə isə onu yerlə yeksan edəcəkdir. Rəbbimin vədi haqiqətdir».*** *(əl-Kəhf 90-98)*[1258]. Zeynəb b. Cəhş - *radıyallahu anhə* – rəvayət edir ki, bir gün Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – üzü qıp-qırmızı halda, həyacanlı olaraq çölə çıxdı və: «***Lə İləhə İlləllah!*** İrəlidə gecə qaranlığı kimi fitnə vardır. Vay ərəbin halına! Bu gün Yəcuc və Məcuc səddindən bu boyda dəlik açıldı» buyurdu. Bunu söylədikdə baş barmağı ilə şəhadət barmağını halqa şəkilində etdi. Bunun üzərinə mən: «Ya Rəsulillah! İçimizdə yaxşı kimsələr olarkən biz həlakmı oluruq?» dedim. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bəli (fasiqlik, fahiş əməllər, əxlaqsızlıq, zülm) kimi pisliklər çoxaldığı zaman»[1259]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yəcuc və Məcuc hər gün səddi qazarlar. Balaca bir dəlik açıldıqda günəşin işıqlarını gördükdə əmrləri onlara: «Gəlin qayıdaq, sabah işimizə davam edərik» deyər. Səhəri ora gəldikdə səddin əvvəlki vəziyyətdə olduğunu görərlər. (Bu hal uzun bir vaxt belə davam edər). Nəhayət Allah onları insanların üzərinə göndərmək vədi gəlib çatdıqda onlar yenə də qazarlar. Səddən günəş işıqları göründükdə əmrləri: «Gəlin qayıdaq, sabah ***İnşəallah*** işimizə davam edərik» deyər. Səhəri ora gəldikdə səddi buraxdıqları halda görürlər. Qazmağa başlayırlar və çıxaraq insanların üzərinə hücum edirlər…»[1260]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü Allah buyuracaq: «Ey Adəm!». Adəm: «Buyur Ya Rəbbim!» deyər. Allah: «Atəşə göndərilənləri atəşə göndər». Adəm: «Nə qədərini?» deyər. Allah: «Hər min nəfərdən doqquz yüz doxsan doqquzunu atəşə, birini isə Cənnətə» deyə buyurar[1261]. İbn Həcər – *rahmətullahi aleyhi* – deyir ki: "Bu hədis onların Adəm - *əleyhissəlam* - ın zurriyyətindən olmasına dəlildir və əksini iddia edənlərin sözlərini rədd edir"[1262]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yəcuc və Məcuc tayfasının çıxmasından sonra da Beyti həcc və

---

[1257] "Minhacus-Sünnə" 2/131, "əl-Mənârûl-Munîf" s: 152-153.
[1258] İncildə Qoq və Maqoq tayfaları. Geniş məlumat üçün bax: «Qurani-Kərim» Kəhf surəsi 83-98-ci ayələrə qədər.
[1259] Müslim.
[1260] Əhməd 2/510,511, İbn Məcə «Fitən» 33,4080, İbn Hibban 15/243, İbn Kəsir 3/105, Qurtubi 11/57.
[1261] Buxari 3/1221, 5/2392, Müslim «İman» 379, 1/201.
[1262] Fəthul Bəri 6/445.

ümrə üçün ziyarət edəcəklər»[1263]. Xuzeyfə b. Yəmən, Abdullah b. Amr - *radıyallahu anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yəcuc və Məcuc tayfası Adəm oğullarındandır. Onlardan biri öz zuriyyətindən min insan görmədən ölməz (Başqa rəvayətdə: Yəcuc bir ümmət, Məcuc bir ümmət. Hər ümmət dörd yüz min nəfərdir və bunlardan hər biri öz övladlarından min silahlı adam görmədikcə ölməz)[1264]»[1265]. Abdullah b. Amr - *radıyallahu anhu* – rəvayət edir ki: "Cinlər və insanlar on qisimdir. Doqquz qismi Yəcuc və Məcucdur. Qalan qismini isə digər insanlar təşkil edir"[1266]. Qatadə - *radıyallahu anhu* – rəvayət edir ki: "Yəcuc və Məcuc **22** qəbilədən ibarətdir. Onların **21**-ni Zülqarneyn səddə həps etmişdir. Digər qəbilə isə döyüş əsnasında itən və səddin arxasında qalan Türklərdir"[1267]. Nəvvas b. Səman - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Müsəlmanlar Yəcuc və Məcucun oxlarını döyüş sürsatlarını **7** il yandıraraq onlardan istifadə edəcəklər"[1268]. Xuzeyfə b. Yəmən - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Yəcuc və Məcucdan soruşuldu. O, buyurdu: "Onlar **3** sinifdirlər: Bir sinif Erz (ağacı) kimidirlər". Ondan: "Erz nədir?" deyə soruşdular. O: "Şamda bitən səmaya doğru **120** zira uzunluğunda olan bir ağacdır. Onlara nə dağ, nə də dəmir dözər. ***İkinci sinif***: "Qulağının birini döşək kimi edər, digərini isə yorğan. Fil, dəvə, donuz nə görsələr yeyərlər. Hətta özlərindən biri ölərsə onu da yeyərlər. Onların bir ucu Şamda, bir ucu da Xorasanda olar. Şərq çaylarının hamısını və Təbəriyyə gölünü içərlər (Başqa rəvayətdə: Bir sinifdə: Orta boyludur. Onlar daha şiddətlidirlər)"[1269].

**6. *Dabbətul-Ardın (Heyvanın) Çıxması*[1270]. *«Onlara deyilən söz yerinə yetdiyi zaman onlar üçün yerdən bir heyvan çıxardarıq ki, onlarla danışıb*** *(bizim adımızdan):* ***«İnsanlar ayələrmizə inanmadılar» deyər.*** *(ən-Nəml 82).* Bu heyvanın nə cür olduğu barədə heç bir məlumat yoxdur. Qeyd edirlər ki, o kimin mömin və kafir olduğunu söyləyəcəkdir. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dəbbətul Ard, Musanın əsası və Süleymanın möhürü bir yerdə çıxacaqdır. Möhür ilə mömininin üzünü parladacaq, əsa ilə kafirin burnunu qıracaqdır. Mömin ilə kafir tanınacaqdır»[1271].

***Cəssasə Kimdir?*** - Fatimə b. Qeys - *radıyallahu anhə* – rəvayət edir ki, bir gün Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ***Əssalətu Cəmiatən*** (toplayıcı olan namaza gəlin) deyə buyurdu. Mən də həmin məscidə gəldim. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə birlikdə namaz qıldım. Mən qadınların səfində idim. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – namazı bitirdikdən sonra gülər bir halda minbər üzərində oturdu və: «Heç kəs namaz qıldığı yerdən ayrılmasın!» buyurdu. Sonra sizləri nə üçün topladığımı bilirsiniz? Səhabələr: «Allah və Rəsulu daha gözəl bilir». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allaha and olsun ki, mən sizi nə bir müjdə vermək, nə də qorxutmaq üçün toplamışam. Lakin mən sizləri bu səbəbə görə

---

[1263] Buxari «Hacc» 47, Əhməd 3/28.
[1264] Təbərani "Əvsat" 4/155, Həkim 4/490, Təbəri 17/88, İbn Kəsir 3/107, Deyləmi 8963, Qurtubi 11/57, Fəthul Bəri 6/386,13/106.
[1265] Heysəmi «Məcmuz Zəvaid» 8/6.
[1266] Həkim 4/536, Fəthul Bəri 13/107.
[1267] Fəthul Bəri 13/107, Tuhfətul Əhfəzi 6/351, Feyzul Qadir 1/117, İbn Kəsir "Bidayə" 2/110,200.
[1268] İbn Məcə 4076, Deyləmi 3463, əl-Albani "Səhihul Cəmi" 3567.
[1269] Qurtubi "Təzkira" 781 zəif hədis.
[1270] ***Dəbbətul Ard*** – bəzi rəvayətlərə görə bu Cəssasədir. Cəssasə Dəccəl üçün xəbərlər aparan cəsus deməkdir.
[1271] İmam Əhməd, Taylasi, Tirmizi, İbn Məcə, Beyhəqi, İbn Cərir.

toplamışam: «Təmim əd-Dari xristian bir adam idi[1272]. Gəldi, beyət edib İslamı qəbul etdi və mənə belə hadisəni rəvayət etdi. Onun söylədiyi bu rəvayət mənim sizə söylədiyim Məsih Dəccəl hadisəsi ilə uyğundur». Sonra söhbətinə davam edərək buyurdu: «Cuzam və Ləhm qəbilələrindən otuza yaxın kişi ilə gəmi ilə səyahətə çıxdıq. Dənizin dalğaları onları bir ay dənizdə çarxalayaraq sonra bir adanın yanına gətirdi. Günəşin batdığını gözlədikdən sonra adaya yollandıq. Adada bizim qarşımıza tüklü bir Dabbə (heyvan) çıxdı. Tükü çox olduğundan biz onun arxa və qabağını seçə bilmirdik. Biz ona: «Sən kimsən?» deyə soruşduq. O, da: «Mən Cəssəsəyəm» dedi. Biz: «Cəssəsə nədir?» deyə soruşduq. O, məxluq: «Ey topluluq siz ibadətgahdakı adamın yanına gedin. Çünki o, sizin gəlməyinizi çoxdan arzulayır» dedi. Dəbbə bizə o, adamı vəsf etdikdə biz onun şeytan olmasından qorxduq. Nəhayət o, ibadətgaha gəldik. Orada cüssə baxımından insanların ən irisi olan, ayaqları əllərinə çarpaz vəziyyətdə bağlanmış birisini gördük. Biz ona: «Sən kimsən?» deyə soruşduq. Qarşılığında o: «Sizlərin kimlər olduğu barədə mənə xəbər verin» dedi. Biz də hər şeyi olduğu kimi ona xəbər verdik. O: «Mənə Şamda olan Nəhmu Beysən adlı yerdən xəbər verin?» dedi. Biz: «Sənə onun hansı halından xəbər verək?» dedik. O: «Xurmalarından deyirəm. Onlar meyvə verirlərmi?» dedi. Biz: «Bəli, verir» dedik. O: «Onun meyvə verməmək vaxtı yaxınlaşır» dedi. O: «Mənə Təbəriyyə gölündən xəbər verin?» dedi. Biz: «Sənə onun hansı halından xəbər verək?» dedik. O: «Onda su varmı?» dedi. Biz: «Onun suyu çoxdur» dedik. O: «Xəbəriniz olsun ki, onun suyunun çəkilib getməsi zamanı yaxınlaşır» dedi. O: «Mənə Şamın qiblə hissəsində olan Aynu Zuqardan xəbər verin» dedi. Biz: «Sənə onun hansı halından xəbər verək?» dedik. O: «O, bulaqda su varmı? Oranın əhalisi o, bulaqdan istifadə edirmi?» dedi. Biz: «Bəli, o suyu bol olan bir bulaqdır. Əhalisi də o, bulağın suyundan istifadə edirlər» dedik. O: «Mənə ***Nəbiyyul-Ummiyin*** (ümmətlərin Peyğəmbəri) haqqında xəbər verin? O, nə edir?» dedi. Biz ona: «Məkkədən çıxıb Yəsribə (Mədinəyə) hicrət edib» dedik. O: «Ərəblər onunla müharibə edirlərmi?» dedi. Biz: «Bəli» dedik. O: «Onun vəzifəsi nədir? Peyğəmbər onlara nə edir?» dedi. Biz: «Ərəblərdən ona dostluq edənlər və itaət edənlər zahir olmuşdur» dedik. O: «Həqiqətən bunlar oldumu?» dedi. Biz: «Bəli» oldu dedik. O: «Şübhəsiz ki, onların peyğəmbərə itaət etmələri onların özləri üçün xeyirlidir» dedi. İndi mən sizə özüm haqqımda xəbər verəcəyəm. Mən Məsihəm. Mənə çıxmaq üçün izn verilən zaman yaxınlaşır. İzn verildikdə mən yer üzündə gəzəcəyəm və qırx gecə içində elə bir yer olmayacaq ki, ora ayağım dəyməsin. Məkkə və Mədinədən başqa. Bunların hər iksi də mənə haram edilmişdir. Bu iki şəhərin hər girəcəyində dayanan mələklər əllərindəki qılınc ilə məni vuraraq bu şəhərlərə girməyə qoymazlar».

Fatimə b. Qeys - *radıyallahu anhə* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bunları söylədi və əlindəki dəyənək ilə minbərə sürtərək və Mədinəni qəsd edərək: «Bura Teybədir! Bura Teybədir! Bura Teybədir!» deyə buyurdu. Sonra xəbəriniz olsun ki, mən bunları sizlərə söylədimmi? deyə buyurdu. Məsciddəki insanlar dedilər: «Bəli! Xəbər verdin!»[1273].

Bütün bu hadisələr öz baş vermə vaxtına görə ardıcıl gələcəklər və bir-birinin ardınca o, qədər sürətlə gələcəklər ki, insanlar göz açmağa imkan belə tapmayacaqlar.

---

[1272] Təmim əd-Dâri - Əbu Rukayyə Təmimi Əvs b. Hâricə əd-Dâri. Lahmilərin bir şöbəsi olan Dâr kökünə mənsubdur. Xristian idi. Beytul-Məqdisin ən məşhur rahibləri arasında sayılırdı. Hicrətin **9**-cu ilində müslüman oldu. Mədinəyə gəldi. Hicri **40**-cı ildə vəfat etdi. "Təhzibut-Təhzib" 1/511-512.

[1273] Müslim.

Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamətin əlamətləri bir-birinin ardınca gələn mirvari dənələri kimidir. İp kəsildikdə dənələr bir-birinin ardınca töküldüyü kimi (Qiyamətin əlamətləri də bir-birinin ardınca bu cür sürətlə) gələcəkdir»[1274]. O, dəhşətli, qulaqları kar edən və insanları sərxoş edən gün gəlməmişdən əvvəl Allaha yönəlin, nə etdikləriniz haqda düşünün. Çünkü o, gün düşünmək artıq fayda verməyəcəkdir. ***«Nəhayət qulaqları kar edən o, dəhşətli səs gələndə. O, gün insan qaçacaq qardaşından, anasından, atasından, zövcəsindən, oğullarından. O, gün onlardan hər birinin istənilən qədər işi olacaqdır».*** *(Əbəsə 31-37).* ***«Onu görəcəyiniz gün hər bir əmizli qadın uşağını unudar, hər bir hamilə qadın vaxtından əvvəl yerə qoyar. İnsanları sərxoş görərsən. Halbuki onlar sərxoş deyillər. Bu ancaq Allahın əzabının şiddətli olmasındandır».*** *(əl-Həcc 2).* Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Günəş batdığı yerdən doğmadıqca Qiyamət qopmaz. İnsanlar onu gördükdə yer üzündə olan hər kəs iman gətirəcəkdir. Əvvəlcədən iman etməmiş heç bir kəsə iman etməsinin fayda verməyəcəyi zamandır»[1275].

## QİYAMƏTİN ADLARI

Qurani Kərimdən bizə məlum olan qiyamət gününün bir çox adları vardır. Məs:

**1. *Yəumul-Bəss*** – məşhərə göndərilən gün. (ər-Rum 56).
**2. *Yəumul-Xuruc*** – çıxarılacaq günü. (Qaf 42).
**3. *Yəumul-Qiyamə*** – qalxacaqları gün. (əl-Qiyamət 1).
**4. *Yəumul-Həşr*** – toplanma günü. (Qaf 44).
**5. *Yəumul-Fəsl*** – ayırd etmə günü. (ən-Nəbə 17).
**6. *Yəumul-Cəma*** – cəm etmə günü. (əş-Şura 7).
**7. *Yəumul-Hisəb*** – haqq-hesab günü. (Sad 16).
**8. *Yəumul-Vaid*** – vəd olunmuş gün. (Qaf 20).
**9. *Yəumul-Həsra*** – peşmançılıq günü. (Məryəm 39).
**10. *Yəumul-Xulud*** – əbədiyyat günü. (Qaf 34).
**11. *Dərul-Xuld*** – əbədiyyət yurdu. (Fussilət 28).
**12. *Yəumut-Tələq*** – qarşılaşma günü. (Ğafir 15).
**13. *Yəumud-Din*** – sorğu-sual günü. (əl-Fatihə 4).
**14. *Həqqa*** – haqq üzə çıxacağı gün. (əl-Haqqə).
**15. *Qariə*** – qəlbləri təşvişə salan gün. (əl-Qariə 1-2).
**16. *Ğaşiyə*** – qəlbləri dəhşət bürüyən gün. (əl-Ğaşiyə 1-2).
**17. *Təğabun*** – qarşılıqlı aldanma günü. (ət-Təğabun).
**18. *Əzifə*** – yaxınlaşmaq günü. (ən-Nəcm 57) və s.

## ÖLÜM

Bizlər ölən yaxud öldürülən, ya da hər hansı bir səbəblə həyatı sona çatan hər bir kəsin əcəli ilə öldüyünə və onun əcəlindən heç bir şeyin əskilmədiyinə iman edirik. *(Ya Muhəmməd!)* ***De ki: «Sizə müvəkkil olan ölüm mələyi canınızı alacaqdır. Sonra da*** *(Qiyamət günü)* ***Rəbbinizin hüzuruna qaytarılacaqsınız».*** *(əs-Səcdə 11).* ***«Can boğaza***

---
[1274] Həkim, Əhməd «Musnəd», əl-Albani «Səhih Hədislər Silsiləsi» 4/361 hədis 1762.
[1275] Buxari, Müslim

***yetişdiyi zaman siz ona baxıb durursunuz*** *(əlinizdən heç bir şey gəlmir).* ***Biz ona sizdən daha yaxınıq, amma siz görmürsünüz! Əgər sizdən*** *(dediyiniz kimi, qiyamət günü əməllərinizə görə)* ***haqq-hesab çəkilməyəcəksə, və əgər*** *(öləndən sonra heç bir dirilmə, haqq-hesab yoxdur)* ***iddianızda doğrusunuzsa, bəlkə o çıxan canı geri*** *(bədənə)* ***qaytarasınız».*** *(əl-Vaqiə 83-87).*

***Ölüm Iki Cürdür***: **1.** ***Yuxu*** – Allah Qurani Kərimdə yuxunu ölüm adlandırır. ***«Allah*** *(əcəli çatan kimsələrin)* ***canlarını öldüyü zaman, ölməyənlərin (hələ əcəli çatmayanların) canlarını isə yuxuda alar».*** *(çünkü yuxu da ölüm kimi bir şeydir, yuxu zamanı ruhun bədənlə əlaqəsi kəsilir)». (əz-Zumər 42).* Həmçinin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – sübh namazına yatıb qaldıqda buyurdu: «Allah bizim ruhumuzu aldı və istədiyi vaxt qaytardı»[1276].

**2.** ***Həqiqi Ölüm – «Yer üzündə olan hər kəs fanidir*** *(ölümə məhkumdur)». (ər-Rahmən 26).* ***«Hər kəs ölümü dadacaqdır».*** *(əl-Ənbiya 35).*

Ölüm acı bir həqiqətdir. Hər bir canlı onunla qarşılaşır, ondan qaça bilmir. Canlı varlılıqların heç biri bu həqiqətə qarşı durmaq qüdrətinə malik deyillər. O, hər an baş verə bilər, onunla böyük də, kiçik də, varlı da, kasıb da, güclü də, zəif də üzləşir. ***«Hər bir kəs ölümü dadacaqdır».*** *(Ali-İmran 185). (Müharibəyə getməyib Mədinədə evlərində)* ***oturan və*** *(müharibəyə getmiş)* ***qardaşları haqqında: «Əgər onlar sözümüzə qulaq assaydılar, öldürülməzdilər» deyənlərə söylə ki, əgər doğru deyirsinizsə, onda*** *(bacarıb)* ***ölümü özünüzdən uzaqlaşdırın.*** *(Ali-İmran 168).*

Hamı onun qarşısında bərabərdir. O, qaçılmaz bir taledir, ondan xilas yoxdur, ona mane olacaq bir qüvvə, bir vasitə də yoxdur. Onun qarşısını almaq, onu gecikdirmək də olmaz. Ona təslim olmaqdan başqa bir çıxış yolu da yoxdur. ***«Heç kəs səhər nə əldə edəcəyini*** *(savab, yaxud günah qazanacağını)* ***heç kəs harada öləcəyini bilməz. Allah isə şübhəsiz ki,*** *(hər şeyi)* ***biləndir və*** *(hər şeydən)* ***xəbərdardır».*** *(Loğman 34).*

Həyatı bəxş edən də Allahdır, müəyyən olunmuş vaxtda, ayrılmış müddətdə insan istər evində, istər ailəsi yanında, istər ruzi axtarışında və s. harda olursa olsun verdiyini geri alan da Allahdır. ***«Harada olursunuz olun, hətta uca və möhkəm qalalar içərsində olsanız belə, ölüm sizi haqlayacaqdır».*** *(ən-Nisa 78).*

Bu günə qədər heç bir kəsə ölməzlik bəxş olunmayıb. Yaradılmışların ən xeyirliləri olan Peyğəmbərlər belə ölümdən yaxa qurtara bilməyiblər. Baxın, görün Allah – *subhənəhu və təalə* – onlar haqqında nə buyurur: *(Ya Muhəmməd!)* ***«Səndən əvvəl də*** *(dünyada)* ***heç kəsə əbədi həyat*** *(ölməzlik)* ***vermədik. Belə olduqda sən ölsən onlar dirimi qalacaqlar?»*** *(əl-Ənbiya 34). (Ya Peyğəmbər!)* ***«Şübhəsiz ki, sən də öləcəksən, onlar da öləcəklər».*** *(əz-Zumər 30).*

Bəli, bu qədər ayələri dinlədikdən sonra «Beş günlük dünyadır, kef etmək lazımdır» deyənlərin aqibəti necə olacaqdır. ***«Xeyr, can boğaza*** *(körpücük sümüklərinə)* ***gəlib yetişəcəyi,*** *(ailə üzvləri tərəfindən onu bu bəladan)* ***kim xilas edə bilər? deyiləcəyi,*** *(can üstə olan kimsə)* ***ayrılıq qəminin gəlib çatdığını anlayacağı, və*** *(ölüm qorxusundan)* ***qıçı-qıçına dolaşacağı zaman, aparılacağın yer Rəbbinin hüzuru olacaqdır*** *(ey insan).* ***Beləliklə o nə*** *(Quranı)* ***təsdiq etdi, nə də namaz qıldı. Amma*** *(Allah kəlamını)* ***yalan saydı,*** *(imandan da)* ***üz döndərdi. Sonra da özünü darta-darta ailəsinin yanına getdi. Vay sənin halına, vay! Yenə də vay sənin halına, vay!».*** *(əl-Qiyamə 26-35).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurur: «Ləzzətlərlə dolu

---

[1276] Buxari, Müslim.

həyata son qoyan ölümü tez-tez yada salın»[1277]. İmam Şafii – *rahmətullahi aleyhi* – deyir ki: «Ey Adəm övladı! Anan səni dünyaya gətirəndə sən ağlayırdın, ətrafdakılar isə sevinirdilər. Elə əməl et ki, ölüm anında onlar yığışıb ağlayanda sən sevinəsən».

Bütün varlılıqların yaradanı Allahdır, qayıdış da Allahadır. Ondan başqa qayıdış məqamı yoxdur. Bu qayıdışdan başqa bir tale yoxdur. Fərq yalnız əməl və niyyətdə, gedilmiş yol və məqsəddədir. Son isə birdir: «Müəyyən olunmuş vaxtda, ayrılmış müddətdə ölümdür, Allaha qayıdışdır, məhşər və toplanış günündə cəmləşməkdir. Allahdan mərhəmət və məğfirət ya da qəzəb və əzabdır». Əbu Zərr əl-Ğifari - *radıyallahu anhu* –, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Uca və Böyük olan Allahdan belə buyurmuşdu: «Ey mənim qullarım! Mən zülmü özümə haram etdim. Onu sizin aranızda da haram edirəm. Buna görə də bir-birinizə zülm etməyin….Ey mənim qullarım, nə etsəniz onlar sizin əməllərinizdi. Mən onları sizin üçün sayıb, sonra əskiltmədən sizə verəcəyəm. Hər kim xeyir əldə edərsə bundan ötrü Allaha həmd etsin. Hər kim də bundan başqa bir şeylə qarşılaşarsa özündən başqa heç kəsi qınamasın»[1278]. Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah o, kəslə görüşmək istəyir ki, o da (Rabbi ilə) görüşməyi arzulayır. O, kəslə görüşmək istəmir ki, o da (Rəbbi ilə) görüşməyi arzulamır». Aişə - *radıyallahu anhə* – dedi: «Ya Rəsulallah! Sən ölümü deyirsən? Axı o bizim xoşumuza gələn bir hal deyildir!». O, dedi: «Yox, bu siz fikirləşdiyiniz deyildir. Mömin bəndəyə Allahın rəhmi, mərhəməti və Cənnəti haqqında xəbər verildikdə o, da onunla (Rəbbi ilə) görüşü arzulayır. Allah da həmin bəndə ilə görüşü arzulayır. Kafir bəndəyə Allahın əzabı, qəzəbi və Cəhənnəmi haqqında xəbər verildikdə o, da onunla (Rəbbi ilə) görüşməyi arzulamır. Allah da həmin bəndə ilə görüşməyi arzulamır»[1279]. Cabir – *radıyallahu anhu* – rəvayət edir ki, mən Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – vəfatından üç gün qabaq belə dediyini buyurduğunu eşitdim: «Sizlərdən hər hansı biriniz Allaha gözəl zənn etməkdən başqa halı üzərə ölməsin»[1280].

***Ölümü Arzulamamaq***: Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Heç biriniz ölümü əsla istəməsin və ölüm gəlmədən də gəlməsinə dua etməyin. Çünki sizdən bir öldüyü zaman əməli kəsilir. Həm də mömінin ömrü ona xeyirdən başqa bir şey artırmaz”[1281]. Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Sizdən kimsə ona toxunan zərərdən ötrü ölümü istəməsin. Əgər bunu etmək mümkün deyilsə onda desin: Ya Rəbbim! Yaşamaq mənə xeyirli olduğu müddətdə məni yaşad, ölümüm mənə xeyirli olduğu zaman ruhumu al (Başqa rəvayətdə: Əgər yaxşı kimsədirsə ümüd edilir ki, yaxşılığı artırsın, Pis kimsədirsə ümüd edilir ki, qayıdar (tövbə) edər)”[1282]. Ənəs - *radıyallahu anhu* – deyir ki: “Əgər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ölümü istəməkdən nəhy etməsəydi ölümü istəyəcəkdik”[1283].

***Allaha İtaət İlə Keçirilən Ömür***: Əbu Bəkrətə - *radıyallahu anhu* – rəvayət edir ki, bir nəfər: “Ya Rəsulallah! İnsanların hansı daha xeyirlidir?” deyə soruşdu. Peyğəmbər

---

[1277] İmam Əhməd 2/293, Tirmizi 2307, Nəsəi 4/5, İbn Məcə 4258, İbn Hibban 2559, əl-Həkim 4/321.
[1278] Müslim.
[1279] Buxari, Müslim.
[1280] Müslim 2877.
[1281] Müslim.
[1282] Buxari, Müslim.
[1283] Buxari, Müslim.

– *sallallahu aleyhi və səlləm* – buyurdu: “Ömrü uzun olub, əməli gözəl olandır”. Sonra adam: “İnsanların hansı daha şərlidir” deyə soruşdu. Peyğəmbər: “Ömrü uzun olub, əməli pis olandır” deyə buyurdu[1284].

***Dini Bir Fitnə Qorxusundan Ölümü İstəmək***: Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət qopmaz o, vaxta qədər ki, qəbrin yanından keçən insanlar – «Kaş ki, onun yerində mən olaydım» deməyincə[1285]. Sovban - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ya Rəbbim! Xeyirli əməllər etməyi, günahlardan çəkinməyi, miskinləri sevməyi mənə nəsib et. İnsanlara bir fitnə təqdir etdiyin zaman məni fitnəyə bulaşdırmadan yanına al!”[1286]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Gecə qaranlığı kimi öldürücü fitnələrdən çəkinin. (Xeyirli əməllər etməyə çalışın!) Çünki səhəri mömin olan axşama kafir olacaqdır, axşamı mömin olan isə səhərə kafir olacaqdır. İnsanlar öz imanlarını (dinlərini) dünya malına satacaqlar»[1287]. Sələflər deyirlər ki: “Ölüm yox olub getmək deyildir. O, ancaq ruhun bədəndən əlaqəsinin kəsilməsidir. Ölüm bir ayrılmaqdır. Ruh ilə bədən arasına girən bir pərdədir. Ölüm bir dəyişiklikdir. Dünyadan Axirətə köçməkdir”. Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ölüm qənimətdir, Günahlar müsibətdir, Fəqirlik rahatlıqdır, Zənginlik cəzadır, Ağıl hidayətdir, cahillik zəlalət və sapıqlıqdır, zülm peşmanlıqdır, itaət gözün nurudur, Allah qorxusundan ağlamaq atəşdən qurtulmaqdır, gülmək bədənin fəlakətidir, günahdan tövbə edən günahsız kimidir”[1288]. Mahmud b. Ləbid - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İki şey var ki, İnsan oğlu onlardan iyrənir. Ölümdən iyrənir, halbuki onun üçün ölüm fitnədən daha xeyirlidir. Malın azlığından iyrənir, halbuki az malın sorğu-sualı daha azdır”[1289]. İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əbu Zərr - *radıyallahu anhu* – ya buyurdu: “Ey Əbu Zərr! Dünya mömininin zindanı, qəbr əminliyi, Cənnət isə qərargahıdır. Dünya kafirin Cənnəti, qəbr onun əzabı, Cəhənnəm isə dönüş yeridir”[1290]. İbni Mubarək və İbni Əbi Şeybə və Mərvəzi Rabi b. Haysəndən rəvayət edir ki: “Mömininin gözlədiyi qeybi şeylər içində ölümdən daha xeyirli heç bir şey yoxdur”[1291]. Əbu Darda - *radıyallahu anhu* – rəvayət edir ki: “Rəbbimə təvəzökarlıq üçün fəqirliyi, ona qovuşmaq üçün ölümü sevərəm, günahlarıma kəffarə üçün xəstəliyi sevərəm”[1292]. Ölüm mələyi İbrahim - *əleyhissəlam* - ın ruhunu almaq üçün gəlmişdir. İbrahim: “Ey Mələkul Movt! Heç dost dostun ruhunu alarmı?”. Ölüm mələyi Rəbbinə dönərək Allah ona buyurdu: İbrahim - *əleyhissəlam* - de: Heç dost dosta qovuşmaqdan çəkinərmi?”. Mələk bunu İbrahim - *əleyhissəlam* - xəbər verincə İbrahim: “Ruhumu al!” dedi[1293]. Həyyan b. əl-Əsvəd deyir ki: “Ölüm bir körpüdür. Dostu dosta qovuşdurur”[1294].

---

[1284] Həkim, Əhməd.
[1285] Fəthul Bəri, Buharî “Fitən” 13/81,82, Nəvəvi şərhi, Müslim “Fitən” 18/34.
[1286] Malik, Bəzzar, İmam Cəlaləddin əs-Suyuti “Qəbir Aləmi”.
[1287] İmam Nəvəvi “Şərh Müslim” 2/133.
[1288] İmam Cəlaləddin əs-Suyuti “Qəbir Aləmi”.
[1289] Beyhəqi zəif hədis, İmam Cəlaləddin əs-Suyuti “Qəbir Aləmi”.
[1290] Əbu Nuaym, İmam Cəlaləddin əs-Suyuti “Qəbir Aləmi”.
[1291] İmam Cəlaləddin əs-Suyuti “Qəbir Aləmi”.
[1292] İbni sad “Tabaqat”, Beyhəqi “Şuab”, İmam Cəlaləddin əs-Suyuti “Qəbir Aləmi”.
[1293] İmam Əhməd, İmam Cəlaləddin əs-Suyuti “Qəbir Aləmi”.
[1294] İmam Cəlaləddin əs-Suyuti “Qəbir Aləmi”.

***Ölümü Xatırlamaq***: Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ölümü çox xatırlayın. Çünki ölümü anmaq günahları təmizlər, insanın əlini dünyadan çəkər, zəngin ikən ölümü xatırlamaq azğınlıqdan qoruyar, fəqir ikən ölümü xatırlamaq yaşamağa razı edər"[1295]. Sələflər deyirlər ki: "Kim ölümü çox zikr etsə ona üç şey ikram olunar: Tövbəni tezləşdirər, qəlbində (az ruzi ilə) qənaətkar olar, ibadətində sevinc və fərəh hiss edər. Kim də ölümü unudarsa ona üç şey ilə cəza verilər: Tövbəni gecikdirər, (az ruzi ilə) qənaətkar olmaz, ibadətində tənbəl olar"[1296]. İbrahim Teymi – *rahmətullahi aleyhi* - deyir ki: "İki şey məndən dünya ləzzətlərini kəsir: "Ölümü və Allahın hüzurunda durmağı zikr etmək"[1297]. İbrahim ət-Teymi – *rahmətullahi aleyhi* - deyir ki: "Ölümü zikr etmək zənginlikdir"[1298]. Kəb – *rahmətullahi aleyhi* - deyir ki: "Kim ölümü haqqıyla tamsa dünyanın müsibət və qəmi ona asant gələr"[1299]. Malik b. Dinar – *rahmətullahi aleyhi* - deyir ki: "Əməl və ibadətdə qəlbin həyat tapması üçün ölümü zikr etmək bəs edər"[1300]. Səfiyyə rəvayət edir ki, bir qadın qəlbinin sərtliyindən Aişə - *radıyallahu anhə* – yə şikayət edir. O: "Ölümü çox zikr et, qəlbin yumşalır" dedi[1301]. Əli - *radıyallahu anhu* – deyir ki: "İnsanlar yatıblar, öldükləri zaman oyanırlar"[1302].

***Ölümü Xatırlamağa Yardımçı Olan Şeylər:*** Bureydə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qəbirləri ziyarət etməkdən sizləri qadağan etmişdim. Artıq onları ziyarət edin…»[1303]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Anam üçün istiğfar diləmək üçün Rəbbimdən izin istədim mənə izin vermədi. Qəbrini ziyarət etmək üçün Rəbbimdən izin istədim mənə izin verdi. Siz də qəbirləri ziyarət edin. Çünki qəbir ziyarəti ölümü xatırladır»[1304]. Əbu Səid - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizlərə qəbir ziyarətlərini qadağan etmişdim. İndi isə kim ziyarət etmək istəyərsə ziyarət etsin. Lakin çirkin söz söyləməsin»[1305].

***Allaha Hüsnü Zən Etmək:*** Cabir – *radıyallahu anhu* – rəvayət edir ki, mən Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – vəfatından üç gün qabaq belə buyurduğunu eşitdim: «Sizlərdən hər hansı biriniz Allaha gözəl zənn etməkdən başqa halı üzərə ölməsin»[1306]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – öz Rəbbindən buyurdu: "Mən qulumun qəlbində iki qorxu və iki əminliyi cəm etmərəm. Kim məndən qorxsa, axirətdə onu əmin edərəm. Kim də dünyada məndən (əzabımdan) əmin olsa, axirətdə onu qorxuda buraxaram"[1307]. Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ölüm anında olan bir gəncin yanına daxil oldu. Ona: "Özünü necə hiss edirsən?" deyə buyurdu. O: "Allaha ümüd edirəm və günahlarıma görə qorxuram" dedi. Peyğəmbər: "Belə bir məqamda qulun qəlbində ümüd və qorxu

---

[1295] İbn Əbi Dunyə, İmam Cəlaləddin əs-Suyuti "Qəbir Aləmi".
[1296] İmam Cəlaləddin əs-Suyuti "Qəbir Aləmi".
[1297] İbn Əbi Dunyə, İmam Cəlaləddin əs-Suyuti "Qəbir Aləmi".
[1298] İmam Cəlaləddin əs-Suyuti "Qəbir Aləmi".
[1299] İmam Cəlaləddin əs-Suyuti "Qəbir Aləmi".
[1300] İmam Cəlaləddin əs-Suyuti "Qəbir Aləmi".
[1301] İmam Cəlaləddin əs-Suyuti "Qəbir Aləmi".
[1302] İmam Cəlaləddin əs-Suyuti "Qəbir Aləmi".
[1303] Müslim 977.
[1304] Müslim 976.
[1305] Əhməd 3/38, Heysəmi 3/57, Nəsəi 4/89.
[1306] Müslim 17/209, 2877. Əbu Davud 2097.
[1307] İmam Cəlaləddin əs-Suyuti "Qəbir Aləmi".

birləşərsə Allah ümüd etdiyini ona verər və qorxduğundan da onu əmin edər”[1308]. İbrahim – *rahmətullahi aleyi* - deyir ki: “Sələflər ölüm üzərə olan kimsəyə Rəbbinə yaxşı zən bəsləsin deyə gözəl əməllərini xatırlamağı gözəl görərdilər”[1309].

***Ölüm Acı Bir Həqiqətdir***: Ölüm acı bir həqiqətdir. Hər bir canlı onunla qarşılaşacaqdır. Ölüm anında insanın nə hislər keçirdiyini və ölümdən sonra nələrin baş verdiyi haqda Bəra b. Azib - *radıyallahu anhu* – rəvayət edir ki, bir gün Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə birlikdə ənsarlardan birini dəfn etmək üçün qəbristanlığa yollandıq. Biz qəbrə yaxınlaşdıq, oranı hələ də qazırdılar. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – üzünü Məkkəyə tərəf çevirərək oturdu. Biz də onun yanında sükut içərisində oturduq. O, əlində olan çubuq ilə yerə bir neçə dəfə vurduqdan sonra başını səmaya qaldırıb iki və ya üç dəfə: «Qəbr əzabından qorunmaq üçün Allaha sığının!» dedi və sözünə davam edərək: «Mömin bəndə bu dünyadan köçüb axirətə qovuşduqda onun yanına səmadan ağ üzlü mələklər gəlirlər. Onların üzü günəş kimi parıldayır, əllərində Cənnət kəfənləri, xoş ətirli Cənnət hanutu (balzam) olur. Gözün son görmə həddi qədər ölən adamdan aralı otururlar». Bundan sonra ölüm mələyi gəlib onun başı üzərində oturaraq deyir: «Ey gözəl nəfs! (ruh) , Allahdan bağışlanma və razılıq qazanmaq üçün üzə çıx!» Möminin nəfsi (ruhu) tuluğun ağzından suyun axdığı kimi rahatlıqla çıxar. Bu zaman göylər və yerlər arasında olan mələklər Allahdan o, gözəl nəfs üçün bağışlanma diləyirlər. Onun qarşısına göylərin bütün qapıları açılır və hər qapının gözətçiləri o, gözəl nəfsin onların yanından ötüb keçməsini Allahdan diləyirlər. Ölüm mələyi nəfsi çıxartdıqdan sonra bir an belə əlində saxlamayıb dərhal onu o biri mələklərə verir. Onlar nəfsi əllərindəki kəfənə bürüyərlər, ona hanut vururlar. ***«Nəhayət birinizin əcəli gəlib çatdıqda onun canını mələklər alar. Onlar** (öz vəzifələrində) **heç bir əyər-əskikliyə yol verməzlər».*** *(əl-Ənam 61).* Bundan sonra mələklər nəfsi səmaya qaldırırlar. Mələklərin yanından ötüb keçərkən deyirlər: «Bu gözəl nəfs kimindir?» Deyirlər: «Filankəs oğlu filankəsdir». Onu dünyada daşıdığı ən gözəl adlarla sadalıyırlar və onunla birinci səma qatına çatırlar. Onlar səma qapısının açılmasını xahiş edirlər və qapılar açılır. Hər bir səmada olan mələklər onunla vidalaşır və onu növbəti səmaya yola salırlar. Nəhayət yeddinci səmaya gəlib çatırlar. Uca və böyük olan Allah buyurur: «Mənim qulum haqqında yazın! Cənnətin ən yüksək yerinə – ***Illiyyuna!***». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu ayəni oxudu: ***«Sən nə bilirsən ki, İlliyyun nədir? O, yazılı bir kitabdır. Onu ancaq yaxın olan mələklər görə bilər».*** *(əl-Mutəffifin 19-21).* Mələklər onun adını İlliyyuna yazdıqdan sonra Allah buyurur: «Onu torpağa qaytarın. Həqiqətən mən onlara vəd vermişəm ki, onları (torpaqdan) yaratmışam, (torpağa) da qaytaracağam və (torpaqdan) da dirildəcəyəm». Mələklər nəfsi torpağa qaytardıqdan sonra qul yaxınlarının dönüb geri getdikləri zaman ayaq səslərini eşidir. Bundan sonra onun yanına iki mələk gəlib onu ayıldaraq soruşurlar: «Sənin Rəbbin kimdir?» O, deyir: «Rəbbim - Allahdır» - «Dinin nədir?» O, deyir: «Dinim İslamdır» - «Sizə göndərilən o, adam kimdir?» O, deyir: «O, Allahın Rəsuludur» - «Bəs, sən nə etdin?» O, deyir: «Allahın kitabını oxudum, ona iman gətirdim və onu təsdiqlədim». Səmadan səs gəlir: «Mənim qulum

---

[1308] İbn Məcə 4261, Tirmizi, Əhməd, İmam Cəlaləddin əs-Suyuti “Qəbir Aləmi”. əl-Albani “Səhihdə” 1051.

[1309] İbn Əbi Dunyə “Kitabul Muhtadirin” s. 39-40.

[1310] ***Nəfs*** **–** bir neçə cürdür. **1.** Sənə pisliyi əmr edən nəfs – ***«Mən özümü təmizə çıxartmıram. Rəbbimin rəhm etdiyi kimsə istisna olmaqla nəfs pis işləri görməyi əmr edir. Həqiqətən Rəbbim bağışlayan və Rəhm edəndir».*** *(Yusif 53).* **2.** Özünü qınayan nəfs – ***«And içirəm özünü qınayan nəfsə».*** *(əl-Qiyamət 2).* **3.** Özünə arxayın nəfs – ***«Ey özünə arxayın nəfs. Dön Rəbbinə, sən Ondan O, da səndən razı olaraq».*** *(əl-Fəcr 27).* İbn Teymiyyə «Məcmuul Fətava» 9/294.

haqqı dedi. Onu Cənnət libasları ilə geyindirin, Cənnət nemətlərindən ona verin və Cənnətin qapısını onun üzünə açın. Onun bədənindən gözəl iy gəlir və məzarı göz görən məsafə qədər genişlənir. Onun yanına xoşsifətli, gözəl geyimli, gözəl ətirli bir nəfər gəlib deyir: «Mən səni sevindirəcək bir xəbərlə gəlmişəm. Allahın sənə verdiyi nemətlərlə sən sevin! Bu gün sənə vəd olunmuş gündür». Mömin təəcüblü halda soruşur: «Sən kimsən? Sənin sifətin xeyirdən xəbər verir». O, deyir: «Mən sənin saleh əməllərinəm. Allaha and olsun ki, mən səni həmişə Allahın əmrlərini yerinə yetirmək üçün can atdığını və qadağalarından çəkinmək üçün çalışdığını görürdüm. Bu da sənin əməllərinin qarşılığında Allahın sənə olan mükafatıdır». Mömin üçün Cənnətin və Cəhənnəmin qapıları açılır. Ona deyilir: «Əgər sən Allaha asi olsaydın, ora (Cəhənnəm) sənin olardı. Lakin Allah oranı sənin üçün Cənnət ilə əvəz etdi». Mömin Cənnətdəki yerini gördükdən sonra Allaha dua edib deyir: «Ya Rəbbim! Qiyamət gününü yaxınlaşdır və mənə imkan ver ki, öz ailəmin, əmlakımın yanına qayıdım».

Kafir bəndə bu dünyadan köçüb axirətə qovuşduqda onun yanına səmadan qara sifətli mələklər gəlirlər. Əllərində Cəhənnəmdən gətrilmiş parça olur. Gözün son görmə həddi qədər ölmüş adamdan aralı otururlar». Bundan sonra ölüm mələyi gəlib onun başı üzərində oturaraq deyir: «Ey xəbis nəfs! (ruh) Allahın qəzəb və nifrətini qazanmaq üçün üzə çıx!» Kafirin nəfsi (ruhu) bədənindən əyri uclu dəmir əsa yaş yundan çıxdığı kimi çıxar. Bu zaman göylər və yerlər arasında olan mələklər onu lənətləyirlər. Onun üçün göylərin bütün qapıları bağlanır və hər qapının gözətçiləri o, xəbis nəfsin onların yanından ötüb keçməməsini Allahdan diləyirlər. Ölüm mələyi nəfsi çıxartdıqdan sonra bir an belə əlində saxlamayıb dərhal onu o biri mələklərə verir. Onlar xəbis nəfsi Cəhənnəmdən gətirdikləri pis qoxulu kəfənə bürüyürlər. Bundan sonra mələklər nəfsi səmaya qaldırırlar. Mələklərin yanından ötüb keçərkən deyirlər: «Bu xəbis nəfs kimindir?» deyirlər: «Filankəs oğlu filankəsdir». Onu dünyada daşıdığı ən pis adlarla sadalıyırlar və onunla birinci səma qatına çatırlar. Onlar səma qapısının açılmasını xahiş edirlər. Lakin qapılar açılmır. Peyğəmbər *– sallallahu aleyhi və səlləm –* bu ayəni oxudu: ***«Ayələrmizi yalan hesab edənlərə və onlara təkəbbürlə yanaşanlara göyün qapıları açılmaz və dəvə iynənin gözündən keçməyənə qədər onlar da Cənnətə daxil ola bilməzlər. Biz günahkarlara belə cəza veririk».*** *(əl-Əraf 40).* Bundan sonra Uca və Böyük olan Allah buyurur: «Onun haqqında yazın! Yerin ən aşağı hissəsinə - Siccinə!». Mələklər onun adını Siccinə yazdıqdan sonra Allah buyurur: «Onu torpağa qaytarın. Həqiqətən mən onlara vəd vermişəm ki, onları (torpaqdan) yaratmışam, (torpağa) da qaytaracağam və (torpaqdan) da dirildəcə-yəm». Mələklər nəfsi torpağa atırlar və Peyğəmbər *– sallallahu aleyhi və səlləm –* bu ayəni oxudu: ***«Allaha şərik qoşan kimsə göydən düşən, quşların onu sürətlə alıb apardığı, yaxud küləyin sovurub uzaqlara apardığı bir şeyə bənzər».*** *(əl-Həcc 31).* Sonra xəbis nəfs yaxınlarının dönüb geri getdikləri zaman ayaq səslərini eşidir. Bundan sonra onun yanına iki mələk gəlib onu ayıldaraq soruşurlar: «Sənin Rəbbin kimdir?» O, deyir: «Mmmm…bilmirəm?!» - «Dinin nədir?» O, deyir: «Mmmm…bilmirəm?!» - «Sizə göndərilən o, adam kimdir?» O, deyir: «Mmmm…bilmirəm?!» Onda mələklər qışqıraraq: «O, Muhəmməddir!» O, isə: «Mmmm…bilmirəm. Mən insanların nə isə danışdıqlarını eşidirdim». Onlar: «Sən bunu eşitdikdən sonra onun ardınca getmədin (itaət etmədin)». Səmadan səs gəlir: «O, yalan deyir! Onu Cəhənnəm libası ilə geyindirin və Cəhənnəmin qapsını onun üzünə açın!». Cəhənnəmin isti havası onun üzünə vurur, onun qəbri o, qədər daralır ki, qabırğaları bir-birinə keçir. Onun yanına

murdar sifətli, murdar libaslı və çox pis qoxulu biri gəlib deyir: «Mən sənin yanına elə bir xəbər ilə gəlmişəm ki, bu gün sən çox qəmgin və məyus olacaqsan. Bu gün sənə vəd olunmuş gündür». Kafir təəcüblü halda soruşur: «Sən kimsən? Sənin sifətindən zəhrimar yağır. Sifətin xeyirdən xəbər vermir?!». O, deyir: «Mən sənin pis əməllərinəm. Allaha and olsun ki, mən səni həmişə Allahın əmrlərini yerinə yetirməyən və Allaha asi olan görürdüm! Bu da sənin etdiyin əməllərin qarşılığında Allahın sənə olan cəzasıdır!». Sonra kafirin yanına kor, kar və lal cəlladı göndərirlər. Əlindəki dəyənəklə hansı ki, bu dünyadakı dağa vurulsaydı onu toz dənələrinə döndərərdi. Onunla kafiri vuraraq toza döndərir. Lakin Allah onu yenə də əvvəlki görkəminə qaytarır. Onun fəryadını, qışqırığını insanlar və cinlərdən başqa hamı eşidir. Sonra Cəhənnəmin qapıları onun üçün açılır və o, qışqıraraq deyir: «Ya Rəbbim! Qoy qiyamət gəlməsin» .

## QƏBİR ALƏMİ

Əhli Sünnə Vəl Cəmaat ölümdən sonra baş verəcək hər bir şeyə iman edir və bütün bunların da axirətə imanın içərsinə daxil olduğuna da inanırlar. O, baxımdan möminlər qəbir fitnəsinə (sualına) qəbirdə olan əzab və nemətlərə inanırlar. Qəbr fitnəsinə gəlincə insanlar qəbrlərində sorğu-sual olunacaqlar: «Rəbbin kim? Dinin nə? Peyğəmbərin kim?». Allaha iman edənlər dünya həyatında da, axirət həyatında da bu suallara cavab vermək üçün sabit olurlar. ***«Allah iman gətirənləri dünyada da, axirətdə də möhkəm bir sözlə*** *(şəhadətlə)* ***sabitqədəm edər. Allah zalimləri*** *(haqq yoldan)* ***sapdırar. Allah istədiyini edər».*** *(İbrahim 27).* O, baxımdan da mömin: «Rəbbim Allah! Dinim İslam! Peyğəmbərim Muhəmməd – *sallallahu aleyhi və səlləm* – dir!» deyə cavab verəcəkdir. Uca Allah zalımları və kafirləri azdıracaqdır. Onlar «Mmmm... bilmirəm?!» deyəcəklər. Münafiqlər və bu xüsusda şübhə içində olan kimsələr isə: «Mən bilmirəm, insanların nə isə söylədiklərini eşidirdim» deyəcəklər. Bu suallardan sonra ya nemət vardır, ya da əzab. Bu da böyük qiyamət qopacağı vaxta qədər davam edəcəkdir. Allah müşrik və kafirlər haqqında buyurur: ***Nəhayət müşriklərdən birinin ölümü gəlib çatdığı zaman o belə deyər: «Pərvərdigara! Məni geri*** *(dünyaya)* ***qaytar! Bəlkə*** *(indiyə qədər)* ***zay etdiyim ömrün müqabilində yaxşı bir iş görüm! Xeyr, bu onun dediyi boş, faydasız bir sözdür. Onların önündə dirilib*** *(haqq-hesab üçün Allahın hüzurunda)* ***duracaqları günə qədər maneə*** *(öldükdən sonra qiyamətədək qaldıqları bərzəx aləmi)* ***vardır».*** *(əl-Muminun 100).* ***Kaş sən zalimləri ölüm əzabı içində çapalayan, mələklərin də əllərini uzadıb çıxarın canlarınızı! Siz bu gün Allaha qarşı nahaq sözlər danışdığınıza və onun ayələrinə təkəbbür göstərdiyinizə görə alçaldıcı bir əzabla cazalandırılacaqsınız! deyəndə görəydin».*** *(əl-Ənam 93).*

Allah Firon əhli haqqında buyurur: ***«Firon əhlini isə şiddətli əzab sardı. Onlar*** *(ölən gündən Qiyamətə qədər qəbr evində)* ***səhər-axşam*** *(gündə iki dəfə)* ***odda yandırılarlar. Qiyamət qopduğu gün isə*** *(deyiləcəkdir)* ***Firon əhlini ən şiddətli əzaba salın».*** *(əl-Mumin 45-46).* İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizdən biri vəfat etdikdə səhər və axşam ona düşəcəyi yer göstərilir. O, kimsə Cənnət əhlindəndirsə Cənnət. O, kimsə Cəhənnəm

---

[1311] əl-Albani «Əhkəmul Cənaiz» s 202, İmam Əhməd 4/287, 295-296, Əbu Davud 4753, İbn Kəsr 2/131, İbn Həcər 3/234, 240.

əhlindəndirsə Cəhənnəm göstərilir və ona: «Bura sənin yerindir, Qiyamət günü Allah səni öz yerinə göndərəcəkdir»[1312]. Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qul qəbirə qoyulub və yaxınları dönüb geri getdikləri zaman, ölü onların gedərkən ayaq səslərini eşidir. Onun yanına iki mələk gəlir. Onlar ölünü oturdub ona: «Sən Muhəmməd deyə bilinən adam haqqında nə bilirsən?» Möminə gəlincə: «Onun Allahın qulu və Rəsulu olduğuna şəhadət edirəm». Bundan sonra ona: «Cəhənnəmdəki yerinə bax! Allah onun yerinə Cənnətdən sənə bir yer verdi və mömin hər iki yeri birdən görür». Başqa rəvayətdə: Möminin qəbiri yetmiş arşın genişlənir. Münafiq ilə kafirə gəlincə ona da: «Sən Muhəmməd deyə bilinən adam haqqında nə bilirsən?» O, da: «Bilmirəm, mən insanların dediklərini təkrarlayırdım». Ona dəmirdən olan dəyənəklə o qədər vurarlar ki, fəryadını (qışqırığını) insanlar və cinlərdən başqa hamı eşidər[1313]. Bəra b. Azim - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah iman gətirənləri möhkəm bir sözlə sabit edər» qəbir əzabı barəsində nazil olub. Qəbirdə ölüyə: Rəbbin kimdir? deyə soruşarlar. O: «Rəbbim Allah, Peyəmbərim Muhəmmədir» deyər. Allahın: «Allah iman gətirənləri dünya və axirətdə möhkəm sözlə sabit edər» ayəsi budur[1314]. Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Zeyd b. Sabit – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə birlikdə Bəni Nəccara aid bir yerə çatdıq. Qarşımıza beş və ya altı qəbir çıxdı. Peyğəmbər: «Bu qəbirlərin sahiblərini tanıyan varmı?» deyə buyurdu. Bir nəfər: «Mən tanıyıram» dedi. Peyğəmbər: «Nə zaman öldülər?» deyə buyurdu. Adam: «Şirk dövründə» dedi. Peyğəmbər: «Bu ümmət qəbirdə fitnəyə məruz qalacaqdır» deyə buyurdu. Əgər ölülərinizi dəfn etməyinizdən qorxmasaydım sizə qəbir əzabını eşitdirmək üçün Allaha dua edərdim»[1315]. Hani, Osman – *radıyallahu anhu* – nun mövlası deyir ki: "Osman – *radıyallahu anhu* – bir qəbirin yanında durdu. Saqqalı yaş olana qədər ağladı. Ona: «Cənnət və Cəhənnəm xatırlandıqda ağlamırdın, lakin qəbri xatırladıqda ağladın» dedilər. Osman – *radıyallahu anhu* – Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in belə buyurduğunu eşitdim: Qəbr axirət mənzillərinin birincisidir. İnsan ondan qurtula bilərsə sonrakılardan qurtulması asantdır. Ondan qurtulmazsa sonrakılar bundan daha çətindir. Əgər ondan nicat taparsansa böyük bir müsibətdən qurtuldun. Əksi təqdirdə sənin qurtulacağını heç güman etmirəm. Osman – *radıyallahu anhu* – sözünə davam edərək Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – bu sözlərini söylədi: "(Axirət mənzərələrindən) heç biri qəbir qədər qorxuducu və vahiməli deyildir"[1316]. İbn Abbas – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* –: «İki qəbirin yanında dayanıb dedi: «Bu qəbirdəkilər günah etdiklərinə görə əzab çəkirlər. Onlardan birisi sidik ifraz etdikdə ondan təmizlənməzdir. Digəri isə söz gəzidirən idi». Sonra yaş bir budaq qıraraq onu iki yerə böldü və hər bir qəbrin üzərinə birini sancdı. Səhabələr: «Nə üçün belə etdin» dedilər. Peyğəmbər: «Budaqlar quruyana qədər qəbir əzabları yüngülləşsin»[1317]. Möminlərə gəlincə Allah buyurur: ***Şübhəsiz ki: «Rəbbimiz Allahdır! deyən, sonra da*** *(sözündə)* ***düz olan kəslərə*** *(ölüm ayağında)* ***mələklər nazil***

---

[1312] Buxari, Müslim.
[1313] Buxari, Müslim 5115.
[1314] Müslim 5117.
[1315] Buxari, Müslim 2867.
[1316] Tirmizi "Zuhd" 5, 2309.
[1317] Buxari 218, Müslim 675.

***olub belə deyəcəklər: «Qorxmayın və kədərlənməyin! Sizə vəd olunan Cənnətlə siz sevinin!».*** *(əl-Fussilət 30).*

Bütün bu hadisələr «***Bərzax***» deyə adlanan aləmdə baş verir. Keyfiyyəti bizə bəlli olmayan bir şəkildə. Çünki ağıl bu keyfiyyəti dərk etməkdə acizdir. Bu dünyada buna bənzər bir şey yoxdur. Qəbir əzabında məqsəd bildiyimiz qəbir çuxurunda görülən əzab deyildir. ***Bərzax*** adı verilən aləmdə görülən əzabdır. Əzabı dadanlar qəbirdə də olsalar, yerin dibində də olsalar, dənizin dibində və ya balığın qarnında da olsalar, yanıb kül olub, küllərini havaya sovursalar da, heyvanlar didib dağıtsalar da bərzax deyilən aləmdə əzab görürlər. ***«Onlara iki dəfə*** *(dünyada və qəbr evində)* ***əzab verəcəyik. Sonra*** *(axirətdə)* ***isə ən böyük əzaba uğrayacaqlar».*** *(ət-Tövbə 101).* Səmura b. Cundəb - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – sübh namazını qıldıqdan sonra hər dəfə səhabələrdən soruşardı: «Sizdən yuxu görən varmı?» Görən öz yuxusunu Allahın izni ilə ona danışardı. Bir gün səhər o, bizə buyurdu: «Həqiqətən bu gecə mənim yanıma iki nəfər gəldi və mənim onlarla getməyimi xahiş etdilər. Mən də onlarla getdim. (Bir müddətdən sonra) uzanmış bir adamın yanına çatdıq. Bir də baxdıq ki, bir başqası əlində olan bir daş parçası ilə uzanan adamın üstündə dayanıb, əlində olan daşı uzanan adamın başına vuraraq başını yarır. Daş yuvarlanıb kənara düşür. Həmin adam gedib daşı götürüb yerinə qayıdıncaya qədər uzananın başı əvvəlki (ilk) vəziyyətini alır. Sonra o, yenidən birinci dəfə etdiyini təkrarlayır. Mən: «Subhənəllah! Bunlar kimlərdir?» dedim. Onlar: «Gedək! Gedək!» dedilər. Biz yolumuza davam edərək (bir müddətdən sonra) üzü üstə uzanmış bir adamın yanına çatdıq. Onun üstündə əlində dəmir qarmaq olan bir nəfər (dəmir qarmağı) üzü üstə uzanan adamın ağzına, burnuna və gözünün bir hissəsinə keçirərək boynunun ardına kimi cırırdı. Sonra üzünün o biri tərəfinə keçib oranı da boynunun ardına kimi cırdıqda digər tərəf əvvəlki vəziyyətini alır və o, birinci dəfə etdiyini yenidən təkrarlayırdı. Mən: «***Subhənəllah!*** Bunlar kimlərdir?» dedim. Onlar: «Gedək! Gedək!» dedilər. Biz yolumuza davam edərək (bir müddətdən sonra) təndirə oxşar bir yerə gəldik. (Ravi deyir: «Zənn edirəm ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu:) Oradan uğultulu və dəhşətli səslər gəlirdi. Biz içəri baxdıqda orada lüt kişi və qadınlar gördük. Aşağıdan atəş onlara yaxınlaşdıqca onlar bağırırdılar. Mən: «***Subhənəllah!*** Bunlar kimlərdir?» dedim. Onlar: «Gedək! Gedək!» dedilər. Biz yolumuza davam edərək (bir müddətdən sonra) bir gölün yanına çatdıq. (Ravi deyir: «Zənn edirəm ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - gölün suyunun qan rəngində olduğunu buyurdu). Baxdıq ki, göldə bir nəfər üzür. Sahildə isə biri yanında bir topa daş ilə dayanıb. Üzən adam üzə bacardığı qədər üzdükdən sonra yanında daş topası olan adamın yanına gəlib ağzını açar. O, da daşları onun ağzına atardı. O, hər dəfə üzüb onun yanına gəldikdə ağzını açar o, da daşları onun ağzına atardı. Mən: «***Subhənəllah!*** Bunlar kimlərdir?» dedim. Onlar: «Gedək! Gedək!» dedilər. Biz yolumuza davam edərək (bir müddətdən sonra) çox iyrənc və çirkin bir adamın yanına gəldik (sən gördüyün çirkin adamların ən çirkini). Atəşi alovlandırır və ətrafında fırlanırdı. Mən: «Bu nədir?» deyə soruşdum. Onlar: «Gedək! Gedək!» dedilər. Biz yolumuza davam edərək (bir müddətdən sonra) içində hər növ çiçəyin olduğu, sıx və uzun ağaçlarla dolu bir baxçaya çatdıq. Baxçanın ortasında başı göyə doğru uzanan, başını görmədiyim uzun boylu bir adam vardı. Adamın ətrafında daha əvvəl heç görmədiyim sayda çox uşaqlar vardı. Mən: «Bunlar kimlərdir?» deyə soruşdum. Onlar: «Gedək! Gedək!» dedilər. Biz yolumuza davam edərək (bir müddətdən sonra) böyük

bir ağacın yanına çatdıq. Bundan əvvəl bundan daha böyük və gözəl ağac görməmişdin. Mənə «Ağaca qalx!» dedilər. Birlikdə o, ağaca qalxmağa başladıq. Nəhayət gəlib bir şəhərə çatdıq. Şəhər qızıl və gümüş kərpicdən tikilmişdi. Şəhərin qapılarına yaxınlaşdıq və açılmasını xahiş etdik. Qapı açıldı, şəhərə girdik. Bizi bir qrup insanlar qarşıladılar. Vücudlarının yarısı gördüklərinin ən gözəli qədər gözəl, digər yarısı isə gördüklərinin ən çirkini qədər çirkin idi. Mənimlə gələnlər: «Gedin, o, çaya girin!» dedilər. Onlar gedib çaya girdilər. Baxdım ki, bu şəhərin ortasından suyu düm ağ olan bir çay axır. Sonra onlar bizim yanımıza gəldilər. Çirkinlik onlardan getmiş və ən gözəl bir hala gəlmişlər. Mənimlə gələnlər mənə: «Bura ***Cənnətul Adndır*** (Ədn Cənnəti). Bu da sənin məqamındır» dedilər. Gözümü yuxarı qaldırdıqda düm ağ bulud kimi bir saray gördüm. Onlar: «Bura sənin evindir» dedilər. Mən də: «***Bərəkəllahu Fikə*** – Allah səni mübarək etsin! Mənə icazə verin ora girim?!» dedim. Onlar: «İndi yox. Lakin nə vaxtsa sən ora girəcəksən» dedilər. Mən onlara: «Bu gecə qəribə mənzərələr gördüm. Bu gördüyüm şeylər nədir?» dedim. Onlar: «İndi sənə onları başa salarıq» dedilər.

İlk gördüyün başı daşla yarılan insan Quran oxumağı öyrənmiş lakin onu tərk etmişdir (Quranı oxumaz və əməl etməzdi) və fərz namazlarına yatıb qalardı. Bu da onun Qiyamətə qədər görəcəyi qəbr əzabıdır. Ağzı, burnu və gözü boynunun ardına kimi cırılan insan isə səhər evindən çıxar-çıxmaz hər tərəfə yalan yayardı (yalan danışardı). Bu da onun Qiyamətə qədər görəcəyi əzabdır. Təndir içində gördüyün kişi və qadınlar isə zinakar kişi və qadınlardır. Bu da onların Qiyamətə qədər görəcəyi əzabdır. Göldə üzən insan isə faiz yeyəndir. Bu da onun Qiyamətə qədər görəcəyi əzabdır. Atəşi alovlandıran çirkin adam isə Cəhənnəmin gözətçisi Malikdir. Baxçada gördüyün uzun boylu adam İbrahim – *ələhissəlam* – dır. Ətrafındakı uşaqlar isə fitrət üzərində ölən uşaqlardır. (Başqa rəvayətdə – Fitrət üzrə doğulan uşaqlardır). Səhabələr: «Ya Rəsulullah! Orada müşriklərin də uşaqları vardır?» Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bəli, müşriklərin uşaqları da»[1318]. Vücudlarının yarısı gözəl və yarısı çirkin olan kimsələr isə yaxşı əməllər ilə pis əməllər etmiş (bərabər olan) kimsələrdir. Allah isə onları bağışlamışdır. Birinci girdiyin ev adi müsəlmanların evidir. Bu ev isə şəhidlərin evidir. Mən Cəbrail, bu isə Mikail – *əleyhimussəllam* – dır. Başqa rəvayətdə - Mənə: «Başını qaldır!» dedilər. Başımı qaldırdım. Bir də nə görsəm yaxşıdır. Üstümdə bulud kimi bir şey vardır. Mənə: «Bu sənin evindir» dedilər. Mən: «Buraxın ora girim» dedim. Onlar: «Sənin ömrün hələ tamamlanmayıb. Onu

---

[1318] Ölmüş körpə uşaqlar haqqında bir cox rəylər var. **1)** Onlar Allahın istəyi altındadırlar. **2)** Onlar hamısı Cənnətlikdirlər**. 3)** Ataları haraya düşəcəksə onlar da oraya düşəcəklər. Valideyinlərinə tabe olurlar. Valideyinlərindən biri Cənnətə girərsə Cənnətə, Cəhənnəmə girərsə Cəhənnəmə girərlər. Aişə - *radıyallahu anhə* – deyir ki, peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən: “Müşriklərin kiçik ikən ölən uşaqlarının axirətdə halı necə olacaqdır?”. O: “Atalarına tabe olurlar”. Heç bir əməl etmədən necə atalarına tabe olurlar. O: “Onların nə əməl etdiklərini Allah bilir” deyə buyurdu. Əbu Davud. **4)** Torpağa çevriləcəklər. **5)** Cənnət ilə Cəhənnəm arasında bir yerdə olacaqlar. **6)** Müşriklərin uşaqları Cənnət əhlinə xidmət edəcəkdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Rəbbimdən kiçik ikən ölən müşrik uşaqlarının Cənnətdə möminlərə xidmət etmələrini istədim. Rəbbim də qəbul etdi”. Həkim, Tirmizi. **7)** Bu məsələni araşdıranda susmaq lazımdır. **8)** Araşdırmamış susmaq lazımdır. **9)** Hamısı Cəhənnəmdədir. **10)** Allah onları imtanhan edəcəkdir. Ən doğru olanı **1**-ci və **10**-cu rəylərdir. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər doğulan təbiətinə görə (fitrət üzərə) doğular. Sonradan ata-anası onu Yəhudiləşdirər, Xristianlaşdırar, Atəşpərəstləşdirər. Həqiqətən heyvalarda dünyaya sağ-salamat gəlirlər. Məgər sən onların içərisində kəsik qulaqlı doğulan görmüsən. *«(Ya Muhəmməd! Ümmətinlə birlikdə)* ***batildən haqqa tapınaraq üzünü Allahın fitri olaraq insanlara verdiyi dinə*** *(İslama)* ***tərəf tut. Allahın dinini heç vəchlə dəyişdirmək olmaz. Doğru din budur, lakin insanların əksəruiyyəti bilməz».*** *(ər-Rum 30)* (Başqa rəvayətdə: Bir nəfər: «Ya Rəsulullah! Əgər uşaq Yəhudi, nəsrani və Məcusi olmamışdan qabaq ölərsə nə deyirsə?». Peyğəmbər: «Allah onların nə edəcəklərini daha yaxşı biləndir)». Müslim 2658.

tamamladıqda ora girəcəksən» dedilər[1319]. Aişə - *radıyallahu anhə* – deyir ki, mən bundan sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in hər namazdan sonra mütləq qəbir əzabından Allaha sığındığını gördüm»[1320].

Bəzi azmış kimsələr qəbir əzabını, qəbir nemətini inkar edirlər. Onlar öz ağıllarına uyaraq deyirlər ki, əgər ölünün qəbiri açılacaq olarsa əvvəlki halı necədirsə elə də görüləcəkdir. Qəbrdə darlıq və genişlik etibarı ilə heç bir dəyişiklik görülməyəcəkdir. Bu səhf və batil fikrə bir neçə yolla cavab vermək olar.

**1.** Əvvala şəriətin gətirdiyi hökmlərə qarşı bu kimi çürük şübhələrlə çıxmaq doğru deyildir. Bu şübhələrin sahibi əgər şəriətin gətirdiyi dəlillər üzərində düşünmüş olarsa, bu şübhələrin batil olduğunu çox gözəl başa düşəcəkdir.

**2.** Bərzəx (qəbir) həyatı hissiyyat orqanları ilə idrak edilməsi mümkün olmayan qeybi aləmdir. Əgər hissiyyat orqanları ilə hiss edilsəydi qeybə iman edənlərlə, qeybi inkar edənlər bərabər olardılar.

**3.** Əzab, nemət, qəbirin genişliyi və darlığı - bütün bunları sadəcə ölü hiss edir, həyatda olan isə hiss etmir. Bu da həyatda yatan bir kimsənin yuxusunda özünü sıxıntılı və dar bir yerdə görməsi kimi və ya geniş, rahat bir yerdə görməsi kimidir. Kənardan o, yatan insana baxan kimsə onda heç bir dəyişikliyin olmadığını, sadəcə yatdığını görür. O, öz çarpayısında, yorğanının altında yatır. Həmçinin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – səhabələri arasında olarkən vəhy gəlirdi. O, özü vəhyi hiss etdiyi halda səhabələr isə o, vəhyi hiss etmirdilər. Mələk onlara bir insan surətində görünür, onlarla danışırdı. Səhabələr isə nə o, mələyi görür, nə də onu eşidirdilər.

**4.** Yaradılmışların eşitməsi, görmələri, hiss etmələri Allahın onlara verdiyi imkanlar çərçivəsindədir. Onların var olan hər bir şeyi eşitməsinə, görməsinə, hiss etməsinə imkan yoxdur. Yeddi səma, yer və onların arasında olan hər şey Uca Allaha həmd və təsbih edir. Allah bəzən yaratdıqlarından istədiyi kimsələrə onların təsbihlərini eşitdirir. Bununla belə bu həqiqət bizim üçün pərdəlidir. ***«Yeddi göy, yer və onlarda olan bütün məxluqat Allahı təqdis edir. Elə bir şey yoxdur ki, Allaha tərif deyib ona şükr etməsin, lakin siz onların*** *(dillərini bilmədiyiniz üçün)* ***təqdisini anlamazsınız. Allah həqiqətən həlim və bağışlayandır».*** *(əl-İsra 44).* ***«(Ey insan!) Məgər göylərdə və yerdə olanların, günəşin, ayın və ulduzların, dağların, ağacların və heyvanların. İnsanların bir çoxunun Allaha səcdə etdiyini görmürsənmi?».*** *(əl-Həcc 18).* ***«Bundan sonra qəlbləriniz yenə sərtləşərək daş kimi, bəlkə də daha da qatı oldu. Həqiqətən bəzi daşların içərisindən nəhrlər axar, bəzisi yarılıb içindən su fışqırar və bəzisi də Allahın qorxusundan yuvarlanıb düşər. Allah sizin etdiklərinizdən əlbəttə xəbərsiz deyildir».*** *(əl-Bəqərə 74).*

Həmçinin şeytanlar və cinlər də eyni şəkildə yer üzündə gəzirlər. Cinlər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in hüzuruna gəlmiş və Quranı dinləmişlər. Bununla belə onlar bizim tərəfimizdən görünməzlər. ***«Şübhəsiz ki, şeytan və onun camaatı sizləri sizin onları görə bilmədiyiniz yerlərdən görürlər. Biz şeytanları iman gətirməyənlərin*** *(kafirlərin)* ***dostları etdik».*** *(əl-Əraf 27).* Buna görə də insan qeyb aləmində baş verən şeyləri dərk etmədiyinə görə sabit olan şeyləri inkar etməsi düzgün bir iş deyildir.

---

[1319] Buxari.
[1320] Buxari, Müslim.

# SUR

Allah bu dünyanın sona çatması hökmünü verirsə İsrafil – *ələhissəlam* – a Sura birinci dəfə üfürməsini əmr edəcəkdir. O, zaman göylərdə və yerdə olanların hamısı (Allahın istədiyi kimsələrdən başqa) öləcəkdir. ***«Sur** (birinci dəfə) **çalınacaq, Allahın istədiyi kimsələrdən başqa dərhal hamı öləcək. Sonra bir daha çalınan kimi onlar** (qəbrlərindən) **qalxıb** (Allahın əmrinə) **müntəzir olacaqlar».*** *(əz-Zumər 68).* ***«Sur çalınacağı gün Allahın istədiklərindən başqa göylərdə və yerdə olanlar dəhşətli bir qorxuya düşər və onların hamısı Rəbbinin hüzuruna müti, zəlil vəziyyətdə gələr».*** *(ən-Nəml 87).* Abdullah b. Amr - *radıyallahu anhu* – rəvayət edir ki, bir bədəvi: «Ey Allahın Rəsulu! Sur nədir?» deyə soruşdu. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İçinə üflənən bir buynuzdur»[1321]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – səhabələrinə xitab edərək buyurdu: «Allah göylərin və yerlərin yaradılışını tamamladıqdan sonra Suru yaradıb İsrafilə təslim etdi. O, sura ağzını dayamış, gözlərini ərşə dikmiş və (üfləməsi üçün) ona əmr verilməsini gözləyir. Əbu Hureyrə: «Ey Allahın Rəsulu! Sur nədir?» dedim. Peyğəmbər: «(İçinə üflənən) Buynuzdur» deyə buyurdu…»[1322]. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mən necə rahat ola bilərəm ki, surun sahibi suru ağzına dayamış, üzünü çevirmiş, qulağını dikmiş, üfləməsi üçün əmr verilməsini gözləyir". Bu səhabələrə ağır gəldi. Bəs biz nə edək Ya Rəsulallah!" deyə soruşdular. Onlara: "***Hasbunəllahi Vənimal Vəkil*** **–** Allah bizə yetər o, nə gözəl vəkildir" deməyi əmr etdi[1323].

Yer üzü düm-düz olacağı zaman, dağlar darmadağın və yumşaq toz dənələri halına düşəcəkdir. Bu dünya günlərinin sonuncusudur. ***«Günəş sönəcəyi zaman, ulduzlar səpələnəcəyi zaman, dağlar yerindən qopardılacağı zaman, dənizlər od tutub yanacağı zaman, ruhlar** (bədənlərə) **qovuşacağı zaman, əməl dəftərləri açılacağı zaman, göy** (yerindən) **qopardılacağı zaman, Cəhənnəm alovlandırılacağı zaman və Cənnət yaxınlaşdırılacağı zaman, hər kəs nə hazır etdiyini biləcəkdir».*** *(ət-Təkvir 1-15).* ***«Göy parçalanacağı zaman, ulduzlar dağılıb səpələnəcəyi zaman, dənizlər qaynayıb bir-birinə qarışacağı zaman, qəbrlər çevriləcəyi zaman, hər kəs nə etdiyini və nə qoyub getdiyini biləcəkdir. Ey** (kafir) **insan! Səni kərim olan Rəbbinə qarşı aldadan nədir?».*** *(əl-İnfitar 1-6).* Abdullah b. Amr - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dəccal öldürüldükdən sonra insanlar iki nəfər arasında heç bir düşmənçilik olmadan yeddi il yaşayacaqlar. Sonra Allah Şam tərəfdən soyuq bir külək göndərər (bir rəvayətdə Yəmən tərəfdən) və artıq yer üzündə qəlbində zərrə ağırlığında xeyir və ya iman olan heç kimsə qalmaz. O, külək qəlbində zərrə qədər iman olan hər kəsin ruhunu alar. Hətta sizdən biriniz bir dağın ortasına girsə belə o, külək o kimsəni təqib edib ruhunu alacaqdır. Yer üzündə ancaq ən şərli insanlar qalacaqlar. Onlar heç bir yaxşılığı tanımaz və heç bir günahı da rədd etməzlər»[1324]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «…Allah sura ikinci dəfə üfləmə əmrini verdikdə İsrafil sura üflədikdə Allahın dilədiyi kimsələrdən başqa hər kəs ölür. Canları alındıqdan sonra Ölüm mələyi Güc və Qüdrət sahibi

---

[1321] Darimi 79/630, Əhməd 2/192.
[1322], Əbu Yala «Musnəd», Təbəri «Təfsir», Beyhəqi «Bas vən Nuşur» 327, Əbu Davud 4742, Tirmizi 2430
[1323] Tirmizi "Qiyamət" 9, 2433, Əhməd 3/73.
[1324] Buxari, Müslim.

Allahın hüzuruna gələrək: «Ya Rəbb! Göylərdə və yerdə sənin dilədiyindən başqa hər kəs ölmüşdü» deyər. Allah: «(Allah hər şeyi bildiyi halda) Həyatda kim qaldı?» deyə buyurar. Mələk: «Ya Rəbb! Ölməz və diri olan Sən həyatda qaldın, ərşi daşıyanlar, Cəbrail, Mikail və mən». Deyər. Allah: «Cəbrail və Mikail də ölsünlər!» deyə buyurar. Canları alındıqdan sonra Ölüm mələyi Güc və Qüdrət sahibi Allahın hüzuruna gələrək: «Ya Rəbb! Cəbrail və Mikail də öldülər. Mən və ərşi daşıyanlar həyatda» deyər. Allah: «Ərşimi daşıyanlar da ölsünlər» deyə buyurar. Ərşi daşıyanlar da ölürlər. Uca Allah ərşə əmr verir ərş suru İsrafildən alır. Bundan sonra Ölüm mələyi Güc və Qüdrət sahibi Allahın hüzuruna gələrək: «Ya Rəbb! Ərşi daşıyan mələklər də öldülər» deyər. Allah: «(Allah hər şeyi bildiyi halda) Həyatda kim qaldı?» deyə buyurar. Mələk: «Ya Rəbb! Ölməz və diri olan Sən həyatda qaldın və bir də mən» deyər. Allah: «Sən də öl» deyə əmr verər. Ölüm mələyi də ölür…»[1325].

Allah İsrafil – *ələhissəlam* – a Sura ikinci dəfə üfürməsini əmr edəcəkdir. O, vaxt kafirlər və münafiqlər: ***«Sur** (ikinci dəfə) **çalınan kimi** (qiyamət günü) **qəbrlərindən qalxıb sürətlə Rəbbinin hüzuruna axışacaqlar. Onlar deyəcəklər: «Vay halımıza! Bizi yatdığımız yerdən** (qəbr evindən) **kim qaldırdı? Bu Rəhmanın məxluqata buyurduğu vəddir. Peyğəmbərlər doğru deyirlərmiş. Yalnız bir dəhşətli səs qopan kimi onlar hamısı qarşımızda hazır duracaqlar».**(Yasin 51,53).*

İki sur arasında olan müddət haqqında dəqiq məlumat yoxdur. Yalnız bir hədisdə Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İki sur arasında **40** vardır». Səhabələr: «Ya Əbu Hureyrə! Bu **40** gündür?» deyə soruşdular. Mən cavab verməkdən çəkindim. Onlar: «Bu **40** aydır?» deyə soruşdular. Mən cavab verməkdən çəkindim. Onlar: «Bu **40** ildir?» deyə soruşdular. Mən buna da cavab verməkdən cəkindim». Sonra: Allah səmadan bir su endirəcəkdir. Onlar yaşıl yabanı bitkisi kimi (yerdən) bitəcəklər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Adəm oğlunun hər bədən üzvünü torpaq yeyəcəkdir. Yalnız bel sümüyünün aşağı hissəsində olan xırda sümük müstəsnadır. İnsan təkrar ondan Qiyamət günü yoğrulacaqdır. Torpaq əbədiyyən onu yeməyəcəkdir»[1326].

## ƏL-BAS - *Öldükdən Sonra Dirilmək –*

***əl-Bas* –** məna etibarı ilə bir şeyi qaldırmaq və hərəkət etdirmək deməkdir. İstilahi mənası isə ölülərin Qiyamət günü dirilərək qəbrlərindən çıxmalarıdır. Uca Allah əməllərin qaşılığını vermək üçün ölümlərindən sonra insanları dirildəcəkdir. Kim zərrə qədər xeyir işləmişsə onu görəcəkdir, kim də zərrə qədər bir pislik etmişsə onun əvəzini görəcəkdir. ***«Kim zərrə qədər yaxşı iş görmüşdürsə, onun xeyrini görəcəkdir, kim zərrə qədər pis iş görmüşdürsə, onun zərərini görəcəkdir».*** *(əz-Zilzal 7-8).* Peyğəmbərlər göndərməyin nəticəsi də elə budur. ***«Və Allah sizi** (atanız Adəmi) **yerdən** (torpaqdan) **bir bitki kimi göyərtdi. Sonra sizi yenə ora qaytaracaq və** (Qiyamət günü dirildib oradan da) **çıxardacaqdır».** (Nuh 17-18). **«Sizi** (Adəmi) **də ondan** (torpaqdan) **yaratdıq. Sizi** (öləndən sonra) **ora qaytaracaq və** (Qiyamət günü) **bir daha oradan** (dirildib) **çıxardacağıq».** (Ta ha 55).*

---

[1325] Əbu Yala «Musnəd», Təbəri «Təfsir», Beyhəqi «Bas vən Nuşur» 327.
[1326] Buxari “Təfsir” Zumər 3, Ammə 1, Müslim “Fitən” 141, 2955, Əbu Davud 4743, Nəsəi “Cənaiz” 117.

Sura ikinci dəfə üfürüləcəyi vaxt ölülər diriləcəklər. O, zaman insanlar aləmlərin Rəbbinin hüzurunda çılpaq, ayaqyalın, paltarsız və xitan (sünnət) olunmamış halda qalxacaqlar. ***«Göyü kitab səhifəsi kimi büküb qatlayacağımız günü** (qiyamət gününü)* ***yadınıza salın.** (O, gün insanları) **ilk dəfə** (yoxdan) **yaratdığımız kimi dirildib əvvəlki halına salarıq».** (əl-Ənbiya 104). **Onlar: «Biz sür-sümük, çürüyüb ovxalanmış torpaq olduğumuz halda, dirilib yeni məxluqmu olacağıq?» deyirlər.** (Ya Muhəmməd!) **De ki: «**(İstəyirsiniz) **daş, yaxud dəmir olun! Və ya ürəyinizdə** (özünüzü dağlar, göylər kimi) **böyük bir məxluq hesab edin!** (Yenə diriləcəksiniz)**». Onlar deyəcəklər: «O, halda bizi kim dirildəcəkdir?» De ki: «İlk dəfə sizi yoxdan yaradan Allah dirildəcəkdir!».** (əl-İsra 49-51).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnsanlar Qiyamət günü çılpaq, ayaqyalın və xitan (sünnət) edilməmiş halda həşr ediləcəklər». Aişə - *radıyallahu anhə* – dedi: «Ey Allahın Rəsulu! Kişilər, qadınlar (birlikdə çılpaq olaraq həşr ediləcəklər və) bir-birlərinə baxmayacaqlar?» Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bu kimi şeylərə baxmaq belə ağır olacaqdır»[1327]. **«**(Qiyaməti inkar edən) ***İnsan: «Mən öldükdən sonra** (qəbirdən) **çıxardılıb diriləcəyəmmi?» deyə soruşur. Məgər insan ilk öncə onu heçdən** (yoxdan) **yaratdığımızı xatırlamırmı?** (Məryam 66-67). **«Məxluqatı əvvəlcə yoxdan var edən, sonra da** (Qiyamət günü) **yenidən dirildəcək».** (ər-Rum 27). **«Məgər onlar göyləri və yeri yaratmış və onları yaratmaqdan yorulmamış Allahın ölüləri də diriltməyə qadir olduğunu görüb anlamırlarmı. Kafirlər Cəhənnəm oduna göstəriləcəkləri gün onlardan soruşacaqdır: «Məgər bu doğru deyilmi!» Onlar: «Bəli, Rəbbimizə and olsun ki, doğrudur!» deyə cavab verəcəklər. Allah buyuracaqdır: «Elə isə** (dünyada) **küfr etdiyinizə görə dadın əzabı».** (əl-Əhqaf 33-34).*

***əl-Bas** - Öldükdən Sonra Dirilis* - sabit, dəyişməz bir haqdır. Kitab, sünnə və müsəlmanların icma ilə qəbul etdikləri həqiqətdir. Bu xüsusda ayələr olduqca çoxdur. Uca Allah öldükdən sonra diriliş haqqında Kitabında dəfələrlə söz açmışdı. Ta ki, insanlar buna iman etsinlər, imanları artsın. Bu böyük gün üçün əməl etsinlər

## əl-BAS - *Öldükdən Sonra Dirilmək* - İNKAR EDƏNLƏRƏ DƏLİLLƏR

**1.** Qurani Kərimdə ayələr dəlildir ki, Allah Qiyamət günü insanları dirildəcəkdir. ***«Kafirlər onlar öldükdən sonra əsla dirilməyəcəklərini iddia edirlər.** (Ya Peyğəmbər!) **De ki: «Bəli, Rəbbimə and olsun ki, siz mütləq diriləcəksiniz. Sonra da** (dünyada) **etdiyiniz əməllər sizə** (bir-bir) **xəbər veriləcəkdir. Bu Allah üçün çox asandır».** (ət-Təğabun 7). (Ya Peyğəmbərim!) **Səndən: «O,** (bizi qorxutduğunuz əzab və ya qiyamət günü) **doğrudurmu?» deyə xəbər alacaqlar. Onlara belə cavab ver: «Rəbbimə and olsun ki, o doğrudur. Siz ondan canınızı qurtara bilməzsiniz».** (Yunus 53).*

**2.** Allah bizlərə ilk yaradılışı xatırlamağı tövsiyə edir. ***«Məgər insan onu nütfədən yaratdığımızı görmədimi ki, birdən-birə** (Rəbbinə) **açıq düşmən kəsilərək, öz yaradılışını unudub: «Çürümüş sümükləri kim dirildə bilər?» deyə hələ bizə məsəl də çəkdi. De ki: «Onları ilk dəfə yoxdan yaradan dirildəcəkdir. O, hər bir məxluqu gözəl tanıyandır».** (Yasin 76-79). **«Məgər insan elə güman edir ki, o başlı-başına buraxılacaq. Məgər o,** (ata belindən ana bətninə) **tökülən bir qətrə nütfə deyildimi?***

[1327] Buxari, Müslim.

***Sonra laxtalanmış qan oldu və Allah onu yaradıb surət verdi. Sonra da ondan bir kişi, biri qadın olmaqla iki cift*** *(həmtay)* ***yaratdı. Elə isə o Allah ölüləri diriltməyə qadir deyildirmi?».*** *(əl-Qiyamə 36-40).* İnsanı bir çox mərhələlərlə yaratmağa qadir olan, onu təkrar diriltməyə qadirdir. Əksinə təkrar diriltmək yoxdan var etməkdən daha asantdır.

***«Elə isə insan nədən yaradıldığına bir baxsın. O, axıb tökülən bir sudan*** *(nütfədən)* ***yaradılmışdır. O, su*** *(kişilərin)* ***bel sümüyündən,*** *(qadınların)* ***köks sümüyündən çıxar. Həqiqətən Allah insanı*** *(öləndən sonra)* ***yenidən diriltməyə qadirdir».*** *(ət-Tariq 5-9).* ***«Ey insanlar! Öləndən sonra yenidən diriləcəyinizə şübhəniz varsa*** *(ilk yaradılışınızı yada salın).* ***Həqiqətən biz sizi*** *(Adəmi)* ***torpaqdan, sonra mənidən*** *(nütfədən)**, sonra laxtalanmış qandan, daha sonra müəyyən, tam bir şəklə düşmüş*** *(vaxtında doğulmuş)* ***və düşməmiş*** *(vaxtından əvvəl doğulmuş)* ***bir parça ətdən yaratdıq ki,*** *(qüdrətimizi)* ***sizə göstərək. İstədiyimizi ana bətnində müəyyən bir müddət*** *(doqquz ay)* ***saxlayar, sonra sizi uşaq olaraq çıxardırıq. Sonra yetkinlik yaşına yetişəsiniz deyə*** *(sizi böyüdərik)**. Kiminiz*** *(bu həddə çatmamış)* ***vəfat edər, kiminiz də ömrün elə bir rəzil çağına çatdırılar ki, vaxtı ilə bildiyini*** *(tamamilə unudub körpə uşaq kimi)* ***bilməz olar».*** *(əl-Həcc 5).*

**3.** Qurumuş torpağı canlandırdığı kimi ölüləri də diriləcəkdir. *(Ya Muhəmməd!)* ***Sən Allahın rəhmətinin əsər-əlamətinə bax ki, torpağı öldükdən sonra necə dirildir. Doğurdan da o, ölüləri diriləndir. Allah hər şeyə qadirdir».*** *(ər-Rum 50).* ***«Onun qüdrət nişanələrindən biri də budur ki, sən yer üzünü qupquru görürsən. Biz ona yağış yağdıran kimi hərəkətə gəlib qabarar. Onu diriləndən şübhəsiz ki, ölüləri də diriləcəkdir. Allah hər şeyə qadirdir».*** *(əl-Fussilət 39). (Ey insan!)* ***Sən yer üzünü qupquru görərsən. Biz ona yağmur endirdiyimiz zaman o, hərəkətə gəlib qabarar və hər növ gözəl bar gətirər. Bu ona görədir ki, Allah haqdır, ölüləri dirildir və o hər şeyə qadirdir».*** *(əl-Həcc 5-6).* Ölü bir ərazinin yağışla canlanaraq üzərində bitkilərin yaşarması, yoxdan yaradan Allahın qiyaməttdən sonra ölüləri diriləcəyinə dəlildir.

əl-Aqili – *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allaha and olsun ki, istər başqası tərəfindən öldürülüb yerə yıxılmış olsun, istər dəfn edilmiş bir ölü olsun, yer üzərində qəbri açılıb yarılmayacaq heç bir kimsə yoxdur..Mən dedim: «Ey Allahın Rəsulu! Çürümüş və yırtıcı heyvanlar bizləri parça-parça etmişkən Allah bizi necə toplayıb bir araya gətirəcəkdir». O, buyurdu: «Mən sənə bunun bənzərini Allahın nemətləri arasından bildirərəm. Sən yerüzünü çürümüş və darmadağınlıq gördüyün vaxt, bu bir daha canlanmaz deyirsən. Uca Allah oraya səmadan yağmur endirdikdən sonra, aradan bir neçə gün keçdikdən sonra sən yenə oranı görürsən. Bu dəfə hər tərəfin qabarıb, canlandığını görürsən. Allaha and olsu ki, o sizləri bir araya gətirib toplamağa qadirdir. Bu səbəblə sizlər də yatdığınız yerlərdən çıxardılacaqsınız»[1328].

**4.** Allah Qurani Kərimdə göyləri və yerləri necə yaratdığını misal çəkir. ***«Doğrudan da göylərin və yerin yaradılışı insanların yaradılışından daha böyük şeydir. Lakin insanların çoxu*** *(bunu)* ***bilməz».*** *(əl-Mumin 57).* ***«Məgər onlar göyləri və yeri yaratmış və onları yaratmaqdan yorulmamış Allahın ölüləri də diriltməyə qadir olduğunu görüb anlamırlarmı?».*** *(əl-Əhqaf 33).* Göylərin və Yerlərin böyüklüyünə rəğmən onları yaradan, onlara görə çox kiçik olan insanı əlbəttə təkrar yaratmağa qadirdir.

---

[1328] İmam Əhməd «Musnəd» 4/13,14.

**5.** Allah insanları diriltdikdən sonra bəzilərinə cəza, bəzilərinə də mükafat verəcəkdir. ***«Yoxsa biz iman gətirib yaxşı işlər görənləri yer üzündə fitnə-fəsad törədənlərlə eyni tutacağıq? Yaxud Allahdan qorxub pis əməllərdən çəkinənləri günahkarlara tay edəcəyik».*** *(Sad 28).* ***«Qiyamət mütləq gələcəkdir. Hər kəs etdiyi əməlin əvəzini*** *(mükafatını, yaxud cəzasını)* ***alsın deyə, mən onu*** *(insanlardan)* ***gizli saxlayıram».*** *(Ta ha 15).* ***«O, pislik edənlərə əməllərinin cəzasını verəcək, yaxşılıq edənləri isə ən gözəl mükafatla*** *(Cənnətlə)* ***mükafatlan-dıracaqdır».*** *(ən-Nəcm 31).* Hər şeyi hikmətlə yaradan Allah insanları başıboş bıraxmaq, onları boşuna yaratmamışdır. Əmir və qadağalarını boşuna verməz, etdikləri əməlləri də hesabsız buraxmaz.

**6.** Allah Qurani Kərimdə insanları əbəs yerə yaratmadığını buyurur. ***«Yoxsa sizi əbəs yerə yaratdığımızı və*** *(Qiyamət günü dirilib haqq-hesab üçün)* ***hüzurumuza qaytarılmayacağınızı güman edirsiniz».*** *(əl-Muminun 115).* Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu. Uca Allah buyurdu: «Adəm oğlu məni yalanladı, lakin o, belə etmək haqqına sahib deyildir. Onun məni yalanlaması: «Məni ilk yoxdan yaratdığı kimi təkrar məni yaratmayacaq-dır» deməsidir. Halbuki təkrar yaratmaq mənim üçün onu ilk yaratmaqdan daha çətin deyildir»[1329].

**7.** Allah Qurani Kərimdə əvvəlki ümmətləri necə diriltdiyini misal çəkir. ***«Və yadınıza salın ki, siz: «Ya Musa, Allahı aşkar surətdə görməyincə, heç vaxt sənə inanmayacağıq» dediyiniz zaman gözünüz görə-görə sizi ildırım vurmuşdu. Bəlkə şükr edəsiniz deyə, biz sizi sonra yenidən diriltdik.*** *(əl-Bəqərə 55-56). «(Ya Muhəmməd!)* ***«Minlərlə adamın*** *(taundan)* ***ölüm qorxusu ilə öz yurdlarını tərk edib getdiklərini görmədinmi?» Allah onlara: «Ölün!» dedi və sonra da*** *(yenidən)* ***diriltdi. Həqiqətən Allah insanlara lütf edəndir, lakin insanların bir çoxu şükr etməzlər.*** *(əl-Bəqərə 243).* ***«Yaxud damları çökmüş, divarları uçulmuş bir kəndin yanından keçən şəxsin əhvalatını bilmirsən? O şəxs: «Əcaba, Allah bu kəndi ölümündən sonra necə dirildəcək» demişdir. Belə olduqda Allah onu yüz il ölü saxladı, sonra dirildərək ondan: «Nə qədər yatmısan?» deyə soruşdu. O da: «Bir gün bəlkədə bir gündən də az» deyə cavab verdi. Allah ona: «Bəlkə yüz il yatmısan, yediyin yeməyə, içdiyin suya bax, hələ də xarab olmayıb. Bir də uzunqulağına bax! Səni insanlar üçün bir ibrət dərsi olmaqdan ötrü belə etdik. İndi uzunqulağının sümüklərinə bax, gör necə onları bir-biri ilə birləşdirir, sonra da onların üzərini ətlə örtürük?» deyə buyurdu. O, şəxsə bunlar aydın olduqda: «Artıq bildim ki, Allah hər şeyə qadirdir».*** *(Ya Muhəmməd!)* ***Xatırla ki, İbrahim: «Ey Rəbbim! ölüləri nə cür diriltdiyini mənə göstər!» dedikdə, Allah: «Məgər*** *(ölüləri diriltməyimə)* ***inanmırsan?» buyurmuşdu. İbrahim: «Bəli, inanıram lakin ürəyim sakit olmaq üçün soruşdum» deyə cavab vermişdi.*** *(Bu zaman)* ***Allah ona buyurmuşdu: «Dörd cür*** *(cins)* ***quş götürüb*** *(səhv salmamaq üçün)* ***onlara diqqətlə bax,*** *(onları parçalayaraq bir-birinə qatandan)* ***sonra hər dağın başına onlardan bir parça at, sonra onları çağır, tez yanına gələcəklər. Bil ki, Allah yenilməz qüvvət və hikmət sahibidir».*** *(əl-Bəqərə 259-260).*

Öldükdən sonra dirilişi inkar edənlərə bu inkar olunmaz dəlillər açıqlandıqdan sonra yenə inkarları üzərində israr edəcək olurlarsa haqqa qarşı bilə-bilə dirənən inadkar kimsələrdəndir. Belələrinin aqibəti: ***«O gün vay halına yalan sayanların! O kəslər ki, haqq-hesab gününü yalan sayarlar. Bunu isə ancaq həddini aşan, günaha***

---

[1329] Buxari, Nəsəi 4/112, Musnəd 2/317,350.

***batan yalan sayar. Ayələrmiz ona oxunduğu zaman: «****(Bunlar)* ***əvvəlkilərin uydurub düzəltdikləri əfsanələrdir!» deyər. Xeyr****, (belə deyildir)* ***Əslində onların qəlblərini qazandıqları günahlar qaplamışdır. Xeyr, o gün onlar Rəbbinin mərhəmətindən məhrum olacaqlar! Sonra Cəhənnəmə varid olacaqlar. Sonra da onlara: «Bu sizin*** *(dünyada)* ***yalan saydığınız Cəhənnəmdir!» deyiləcəkdir».*** *(əl-Mutaffifin 10-17).*

## HƏŞR VƏ MƏHŞƏR

Əhli Sünnə vəl Cəmaat insanların öldükdən sonra sorğu-sual olunmaları üçün Həşr olunacaqlarına da iman edirlər. İnsanlar dirildikdən sonra mələklər onları çılpaq, ayaqyalın və xitan olunmamış (sünnətsiz) olaraq Mevqif (hesab üçün durulacaq yer) deyə adlanan yerə həşr edəcəklər. ***«Siz bizim hüzurumuza ilk dəfə sizi yaratdığımız kimi tək-tənha, özü də sizə verdiyimiz*** *(var-dövləti, əhli-əyalı)* ***arxanızda*** *(dünyada)* ***qoyub gəlmisiniz».*** *(əl-Ənam 94).* ***«Biz Qiyamət günü onları üzü üstə sürünə-sürünə, kor, lal və kar kimi məhşər ayağına çəkəcəyik».*** *(əl-İsra 97).* ***«O, gün*** *(Qiyamət günü)* ***dağları*** *(yerindən qoparıb)* ***hərəkətə gətirəcəyik.*** *(O vaxt)* ***yeri dümdüz görəcəksən,*** *(möminləri və kafirləri)* ***bir yerə toplayacaq, onların heç birini*** *(kənarda)* ***qoymayacayıq».*** *(Kəhf 47).* ***«O, gün*** *(Qiyamət günü)* ***biz müttəqiləri Rəhmanın hüzuruna möhtərəm elçilər*** *(şahanə qafilərlə gələn əziz qonaqlar)* ***kimi cəm edərik».*** *(Məryam 85-86).* ***«O, gün insanlar*** *(qəbrlərindən qalxıb)* ***heç bir başqa tərəfə meyl etmədən*** *(hamını məhşərə)* ***çağıran İsrafilin ardınca gedəcəklər. Rəhmanın*** *(əzəməti və heybəti)* ***qarşısında səslər kəsiləcək, yalnız pıçıltı eşidəcəksən».*** *(Ta ha 108).* ***«Siz*** *(ey insanlar!)* ***üç zümrəyə ayrılacaqsınız, sağ tərəf sahibləri. Kimdir onlar? Sol tərəf sahibləri. Kimdir onlar? Və birdə öndə olanlar, öndə olanlar!»*** *(əl-Vaqiə 7-10).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnsanlar Qiyamət günü çılpaq, ayaqyalın və və xitan olunmamış (sünnətsiz) halda həşr ediləcəksiniz və şübhəsiz yaradılmışlar arasında Qiyamət günündə ilk paltar geyindirilən adam İbrahim – *əlehissəlam* – olacaqdır[1330]». Aişə - *radıyallahu anhə* – dedi: «Ey Allahın Rəsulu! Kişilər, qadınlar (birlikdə çılpaq olaraq həşr ediləcəklər və) bir-birlərinə baxmayacaqlar?». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bu kimi şeylərə baxmaq belə ağır olacaqdır»[1331]. Abdullah b. Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şübhəsiz ki, sizlər Allaha yürüyərək, çılpaq, ayaqyalın və sünnətsiz olaraq qovuşacaq-sınız»[1332]. Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü insanlar üç qrup olaraq həşr ediləcəklər. Yürüyənlər sinifi, miniklilər sinifi və üzü üstə sürünənlər sinifi». Ey Allahın Rəsulu! Nəcə olur ki, kafir üzü üstə həşr edilir». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dünyada onu iki ayağı üstündə yeridən, Qiyamət günündə onu üzü üstə yeritməyə qadir deyilmi?»[1333]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü insanlar üç qrup olaraq həşr ediləcəklər. Birinci firqə - istəklilər, qorxanlar. İkinci firqə - İkisi bir dəvə üstündə, üçü bir dəvə üstündə, dördü bir dəvə üstündə, onu bir dəvə üstündə olaraq (məşhərə) gələrlər. Qalanlarını isə məşriqdən alıb önünə qataraq

---

[1330] İbrahim - *əleyhissəlam* - ın geyindirilməsinə səbəb: Oda atıldığı zaman qövmü tərəfindən soyundurulub atılmasıdır. Buna görə də Allah Qiyamət günü ilk olaraq onu geyindirəcəkdir.

[1331] Buxari, Müslim 5102.

[1332] Müslim 5103.

[1333] Buxari, Müslim 5105, 5020.

məğribə götürən və orada toplayacaq olan bir atəşdir (Başqa rəvayətdə: Atəş onları önünə qatıb həşr yerinə gətirəcəkdir. Atəş onların dincəldikləri yerdə dincələr, axşamladıqları yerdə də onlarla birlikdə axşamlar, sabahladıqları yerdə isə onlarla bərabər sabahlayar)»[1334].

***Movqif*** **–** (hesab üçün durulacaq yerdə) günəş insanların başlarına doğru yaxınlaşacaqdır və insanları tər, həyacan bürüyəcəkdir. Kimi topuqlarına qədər, kimisi diz qapaqlarına qədər, kimisi sinəsinə qədər, kimisi də qırtlağına qədər tərə düşəcəkdir. ***«****(Ya Muhəmməd!)* ***Allahı zalimlərin etdikləri əməllərdən əsla qafil sanma! Allah onları cəzasını yubadıb elə bir günə saxlayır ki, həmin gün gözləri hədəqəsindən çıxar. Belə ki, onlar başlarını yuxarı qaldırıb durar, gözlərini də qıpa bilməzlər. Onların qəlbləri də boşdur».*** *(Ürəkləri duyğusuzdur, orada xeyrdən heç bir əsər-əlamət yoxdur). (İbrahim 42-43).* ***«****(Ya Peyğəmbər!)* ***Onları ürəklərin ağıza gələcəyi, udquna belə bilməyəcəkləri yaxın günlə qorxut.*** *(O, gün)* ***zalimlərin nə bir dostu, nə də sözü keçən bir şəfaətçisi olar. Allah gözlərin xəyanətini və qəlblərin gizlətdiyini biləndir».*** *(əl-Mumin 18).* ***«Ey cinlər və insanlar! Sizinlə əməlli-başlı məşğul olacağıq».*** *(ər-Rəhman 31).* ***«Ruhun*** *(Cəbrailin)* ***və mələklərin səf-səf duracağı gün Rəhmanın izn verdiyi kimsələrdən başqa heç kəs danışmayacaq, danışan da doğrunu deyəcəkdir».*** *(ən-Nəbə 38).* Cabir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qul hansı halı üzərə ölmüşsə, yenə də o, halı üzərə diriləcəkdir»[1335]. İbn Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «İnsanlar aləmlərin Rəbbi üçün Qiyama durduqları gün – ayəsi barəsində belə buyurduğunu xəbər verdi: İnsanların hər biri qulaqlarının yarısına qədər tərə batmış olaraq qiyama duracaqlar"[1336]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Şübhəsiz ki, Qiyamət günü tər yerin dibini **70** qulac isladacaqdır və heç şübhəsiz ki, insanların təri ağızlarına, qulaqlarına qədər çatacaqdır. Ravi Sevr: "Bunların hansını söylədiyində tərəddüt etmişdir»[1337].

Əməllərinə görə isə bir qrup insanlar o, dəhşətli bir gündə Allah – *subhənəhu və təalə* – nin kölgəsi altında olacaqlar. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yeddi sinif insan vardır ki, heç bir kölgənin olmadığı bir gündə Allah onları öz kölgəsi altında kölgələyəcəkdir: «Ədalətli imam (dövlət başçısı), Allaha ibadət etməklə böyüyən bir gənc, qəlbi məscidlərə bağlı olan bir kimsə, bir-birlərini Allah rizası üçün sevən kimsə (görüşəndə də, ayrılanda da bunu Allah üçün edərlər), gözəl bir qadın tərəfindən (zinaya) çağırılan zaman - *mən Allahdan qorxuram* - deyib ondan uzaqlaşan kimsə, sağ əlin verdiyini sol əlinin bilməyəcəyi şəkildə (gizli) sədəqə verən kimsə, təklikdə Allahı yad edib göz yaşı tökən kimsə»[1338]. Allah bizi də onlardan etsin. Amin!

## HAQQ-HESAB

Əhli Sünnə vəl Cəmaat insanların dirildikdən sonra əməllərinin qarşılığının veriləcəyinə və əməllərinin hesaba çəkiləcəyinə inanırlar. Əməl səhifələri açılacaqdır.

---

[1334] Buxari «Ənbiya» 1/4, 7/194, Müslim «Fitən»39.
[1335] Müslim «Cənnət» 3/83.
[1336] Müslim 5106.
[1337] Buxari "Riqaq" 47, Müslim "Cənnət" 61, 2863.
[1338] Buxari, Müslim.

Kitabı sağ tərəfdən veriləcək olanlar yüngül haqq-hesab olunacaqlar və onlar yaxınlarının yanına sevinclə dönəcəkdir. Kitabı sol tərəfdən və ya arxa tərəfdən verilən kimsə isə həlak olmasını təmənna edərək Cəhənnəmə atılacaqdır. O: «Kaş ki, mənə kitabım verilməyərdi! Kaş ki, hesabımın nə olduğunu bilməzdim!» deyəcəkdir. ***«Peyğəmbər göndərilən ümmətləri sorğu-suala çəkəcək, göndərilən peyğəmbərləri də sorğu-sual edəcəyik».*** *(əl-Əraf 6).* ***«Əməl dəftərləri açılacağı zaman».*** *(ət-Təkvir 10).* ***«Kimin əməl dəftəri sağ əlinə verilmişsə onunla yüngül haqq-hesab çəkiləcək və o, ailəsinin, yaxınlarının yanına sevinclə qayıdacaqdır. Kimin əməl dəftəri arxa tərəfdən verilmişsə o: «Ay öldüm!» deyə şivən qopardacaq və Cəhənnəmə varid olacaqdır».*** *(əl-İnşiqaq 7-10).* ***«Əməl dəftəri sağ əlinə verilən kimsə deyəcəkdir: «Alın, əməl dəftərimi oxuyun. Mən öz hesabıma yetişəcəyimə möhkəm inanmışdım!» Bundan belə o, xoş güzaran içində yüksək bir Cənnətdə olacaqdır. Əməl dəftəri sol əlinə verilən isə deyəcəkdir: «Kaş əməl dəftərim mənə verilməyəydi, hesabımın nə olduğunu bilməyəydim!».*** *(əl-Haqqə 19-27).* ***«Əməl dəftəri qarşısına qoyulacaq.*** *(Ya Muhəmməd!)* ***günahkarların orada yazılmış pis əməllərindən qorxduqlarını görəcəksən. Onlar belə deyəcəklər: «Vay halımıza! Bu əməl dəftəri niyə heç bir kiçik və böyük günahlarımızı nəzərdən qaçırmadan hamısını sayıb qeydə almışdır».*** *(əl-Kəhf 49).* ***«Biz hər bir insanın əməlini öz boynundan asar və qiyamət günü*** *(bütün əməllərini)* ***açıq kitab kimi qarşısına qoyarıq. Oxu kitabını. Bu gün sən özün-özünə haqq-hesab çəkməyə kifayətsən».*** *(əl-İsra 13-14).* Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – güldü və nəyə görə güldüyünü səhabələrdən soruşdu. Biz: «Allah və Rəsulu daha gözəl bilir» dedik. Peyğəmbər: «Qulun Rəbbinə olan xitabından» deyə buyurdu. Qul: «Ey Rəbbim! Sən məni zülmdən qorumadınmı?» dedi. Allah: «Bəli, qorudum» deyə buyurar. Qul: «Mən bu gün özüm üçün özümün şahidliyindən başqa heç kəsi istəmirəm» deyər. Allah: «Bu gün sənə tək şahid olaraq nəfsin, çox şahid olaraq Kiramən Kətibin kifayət edər». Ağzına möhür vurulur və digər orqanlarına danış deyilər. Onlar da qulun əməlini bir-bir xəbər verərlər. Sonra qul danışmaq üçün sərbəst buraxılır. Qul orqanlarına: «Vay olsun sizə! Uzaq olun məndən! Mən sizin qurtulmağınız üçün çalışırdım» deyər[1339].

Qiyamət günü tərəzilər qurulacaq və bununla qulların əməlləri çəkiləcəkdir. Qulun əməllərinin əvəzi hesaba çəkiləcəkdir və etdiklərinin qarşılığı onlara veriləcəkdir. ***«O, gün əməllərin çəkilməsi haqdır. Tərəziləri ağır gələnlər nicat tapanlardır. Tərəziləri yüngül gələnlər isə ayələrmizə haqsızlıq etdiklərindən özlərinə zərər eləyənlərdir».*** *(əl-Əraf 8-9).* ***«Biz Qiyamət günü ədalət tərəzisi qurarıq. Heç kəsə əsla haqsızlıq edilməz. Bir xardal dənəsi ağırlığında olsa belə, hər hansı bir əməli nəzərə alarıq. Haqq-hesab çəkməyə biz kifayətik».*** *(əl-Ənbiya 47).* ***«O, gün tərəzisi ağır gələn kimsə*** *(Cənnətdə)* ***xoş güzaran içində olacaqdır! Tərəzisi yüngül gələn kimsənin isə Məskəni Həviyə olacaqdır! Bilirsənmi Həviyə nədir? O, çox qızmar bir atəşdir».*** *(əl-Qariə 6-11).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər kim incədən-incəyə (yüngül) hesaba çəkilərsə o, əzaba uğramış olacaqdır». Aişə - *radıyallahu anhə* – dedi: Allah: ***«Onunla yüngül haqq-hesab çəkiləcək».*** *(əl-İnşiqaq 8)* deyə buyurmadımı?» Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «O, əməllərin ərzi haqqındadır. Qiyamət günü hesaba çəkilən əzab görəcəkdir»[1340]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu:

---

[1339] Müslim 2969.
[1340] Buxari, Müslim 5122.

«Heç şübhəsiz ki, Qiyamət günü iri cüssəli, yekə bədənli birini gətirirlər. Lakin Allah yanında ağcaqanadın qanadı ağırlığında (bir savabı) da olmaz. Bu ayəni oxuyun: ***«Onlar o, kəslərdir ki, Rəbbinin ayələrini və onun hüzurunda duracaqlarını inkar etdilər. Onların bütün əməlləri puça çıxmışdı. Buna görə də biz onlar üçün heç bir daş-tərəzi qurmayacağıq».*** *(əl-Kəhf 105)*[1341]. Abdullah b. Amr b. As - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü tərəzilər qurulur. Adam gətrilir və tərəzinin bir gözünə qoyulur. Əməllərini isə digər gözünə qoyurlar. (Günah) əməlləri çox olduğundan o, adam Cəhənnəmə göndərilir. Cəhənnəmə gedərkən Allahın yanından bir carçı: «Tələsməyin! Onun çəkilməmiş bir həsənəti qaldı» deyər. Üzərində ***Lə İləhə İlləllah*** yazılmış bir kağız parçası gətrilir və adamla birlikdə tərəziyə qoyulur və tərəzisi ağır gəlir»[1342]. İbn Məsud - *radıyallahu anhu* – bir dəfə Ərak ağacından bir misvaq qırdıqda ayaqlarının olduqca incə olduğundan onu görənlər gülməyə başladılar. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Nəyə gülürsünüz?». Onlar: «Ey Allahın Rəsulu! Ayaqlarının incəliyinə gülürük!» O, buyurdu: «Nəfsim əlində olan Allaha and olsun ki, onlar mizanda (tərəzidə) Uhuddan da ağır gələcəklər»[1343]. Əbu Darda - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Tərəziyə qoyulacaq ən ağır şey gözəl əxlaqdır»[1344].

Bütün bu əməllərdən başqa insanın etdiyi zikrlər də tərəzilərdə çəkiləcəkdir. Əbu Məlik əl-Əşari - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Təharət imanın yarsıdır, ***Əlhəmdulilləh*** də mizanı doldurur»[1345]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Rəhmanın sevdiyi, mizanda ağır gələn və dildə yüngül iki kəlmə vardır: «***Subhənəllahi və Bihəmdihi və Subhənəllahil Azim***»[1346].

Qulun etdiyi bütün əməllər çəkiləcəkdir. Əgər xeyr işləmişsə xeyr görəcəkdir, əgər pislik etmişsə pisliklə qarşılaşacaqdır. ***«Kim zərrə qədər yaxşı iş görmüşdürsə, onun xeyrini görəcəkdir, kim zərrə qədər pis iş görmüşdürsə, onun zərərini görəcəkdir».*** *(əz-Zilzal 7-8).* ***«Rəbbinə and olsun ki, biz onların hamısını sorğu-suala çəkəcəyik».*** *(əl-Hicr 92).* ***«Oğlum bir xardal dənəsi ağırlığında olsa da, bir qayanın içində, yaxud göylərdə və ya yerin tərkində olsa da, Allah onu ortaya gətirər. HəqiqətənAllah bütün incə və nazik işləri bilən Lətif və xabirdir».*** *(Loğman 16).*

Buna görə də yaxşılıq on qatdan yeddi yüz qata və Allahın qullara olan lütfü, qullarına bir ehsan olmaq üçün daha çox qatlarla da mükafatlan-dırılacaqdır. Pis əmələ gəldikdə isə pisliyin də əvəzi onun bir bənzəri olacaqdır. İnsan işlətdiyi pislikdən başqası ilə cəzalandırılmayacaqdır. ***«Kim yaxşı bir iş görərsə, ona həmin işin on qat əvəzi verilər. Kim pis bir iş görərsə, ona həmin işin misli qədər cəza verilər. Onlara haqsızlıq edilməz».*** *(əl-Ənam 160).* İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – də Uca və Böyük Allahdan etdiyi rəvayətdə buyurur: «Allah bütün yaxşı və pis əməlləri yazmışdır». Sonra bunu açıqladı: «Hər kim bir yaxşılıq etməyi niyyət edib, lakin onu yerinə yetirməzsə Allah onu öz dərgahında tam bir həsənət (savab) olaraq yazar. Hər kim də bir yaxşıliq etməyi niyyət edib və onu

---

[1341] Müslim 4991.
[1342] Əhməd 2/221.
[1343] İmam Əhməd «Musnəd» 1/420,421, Təbərani 8452.
[1344] Əhməd 6/452, Tirmizi «Birr».
[1345] Müslim.
[1346] Buxari, Müslim.

yerinə yetirərsə, Allah onu öz dərgahında on həsənətdən, yeddi yüz həsənətə qədər yazar. Hər kim bir pis əməl etməyi niyyət edib, lakin onu yerinə yetirməzsə, Allah onu öz dərgahında bir həsənət olaraq yazar. Hər kim bir pis əməl etməyi niyyət edib və onu yerinə yetirərsə, Allah onu öz dərgahında tam bir pis əməl olaraq yazar»[1347].

***Qiyamət Günü Haqq-Hesab İki Cür Olacaqdır***:

**1. *Hisəbul-Ərz*** – təqdim etmək deməkdir. Onlara əməlləri təqdim olunacaqdır. Məs: Əbu Abdurrahman ən-Nubulli deyir ki, mən Abdullah b. Amr - *radıyallahu anhu* – nun belə dediyini eşitdim: Rəsulullah - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü mənim ümmətimdən bir nəfəri bütün insanların qarşısında çağıracaqlar. Onun qarşısına günahlarla dolu doxsan doqquz kitab qoyulacaq. Hər birinin uzunluğu gözün son görmə həddi qədər olacaqdır». Sonra ondan soruşacaqlar. «Sən bunlardan hansınısa inkar edirsən?» O: «Yox, ya Rəbbim!» deyəcəkdir. Allah buyuracaq: «Səndə bunlara qarşı bir yaxşı əməl varmı?» Həmin şəxs qorxudan özünü itirərək: «Yox, ya Rəbbim!» deyəcəkdir. Ona deyiləcək: «Sənin bir yaxşı əməlin var. Bu əməlinə görə sənə bu gün ədalətsizlik olunmayacaqdır». Onun qarşısına: «***Lə İləhə İlləllah***» kəlməsi yazılmış vərəqə çıxarılacaq. Həmin insan deyəcək: «Ya Rəbbim! Bu vərəq bu qədər günahların qarşısında nə gücə malikdir». Günahları tərəzinin bir gözünə, həmin kəlməni isə tərəzinin o, biri gözünə qoyacaqlar. «***Lə İləhə İlləllah***» olan tərəzi ağır gələcəkdir. Rahmən və Rahim olan Allahın adı qarşısında heç bir şey ağır gəlməz»[1348].

**2. *Hisəbun-Niqaş*** – münaqişə etmək deməkdir. Onlarla etdikləri əməllərə görə münaqişə ediləcəkdir. Məs: İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah mömini yaxınlaşdırar. Onun üzərinə örtüyünü qoyar və onu örtər. Ona buyurar: «Filan günahını bilirsənmi? Filan günahını bilirsənmi?» Qul: «Bəli, ya Rəbbim!» deyər. Bütün günahlarını tək-tək ona söyləyərlər. Qul artıq həlak olduğunu zənn etdiyi təqdirdə Allah ona buyuracaq: «Dünyada ikən səni bu günahlardan saxladım. Bu gün də bu günahlarını sənə bağışlayıram». Sonra ona etdiyi yaxşılıqların yazıldığı kitabı verərlər.

Kafir və münafiqə gəlincə: «Bütün insanların eşitdiyi bir şəkildə onlara deyiləcək. Bunlar Rəbbinə qarşı yalan söyləyən kimsələrdir. Bunu da bilin ki, Allahın lənəti zalimlərin üzərinədir» deyiləcəkdir. ***«Allaha iftira yaxandan daha zalim kim ola bilər? Onlar Allahın hüzuruna gətirilər, şahidlər belə deyərlər: «Bunlar Rəbbi barəsində yalan söyləyənlərdir!» Bilin ki, zalimlər Allahın lənətinə gələcəklər.*** *(Hud 18)*[1349]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü kafir gətrilir və ona: «Nə deyirsən? Əgər yer dolusu qədər qızılın olsaydı onu (qurtarmaq üçün) fidyə verərdin?» deyə soruşulacaq. O: «Bəli» deyə cavab verəcəkdir. Bu dəfə ona deyiləcək: «Səndən daha yüngül və asandı istənilmişdi». Bir rəvayətdə: «Mənə heç bir şeyi şərik qoşmamağın (istənilmişdi). Lakin sən şərik qoşmaqdan başqa bir şey qəbul etmədin!»[1350].

Kafirlərin yaxşı və pis əməlləri tərəzidə çəkiləcək kimsələrin əməlləri kimi hesaba çəkilməyəcəkdir. Çünki onların yaxşı əməlləri yoxdur. Ancaq əməlləri sayılıb və əməllərindən xəbərdar olunacaqlar. Onlara etdikləri söyləniləcək və bununla da rəzil

---

[1347] Buxari, Müslim.
[1348] Tirmizi 2641,2639, İbn Məcə 1437,4300, Əhməd 4/213, əl-Həkim 1/5,6
[1349] Buxari, Müslim.
[1350] Buxari, Müslim.

ediləcəklər. ***«Biz onların etdikləri əməlləri qəsdən dağınıq zərrələrə döndərərik».*** *(əl-Furqan 23).* ***«Rəbbini inkar edənlərin əməlləri fırtınalı bir gündə küləyin sovurub apardığı külə bənzəyir. Onlar etdikləri əməllrdən heç bir fayda əldə edə bilməzlər. Budur*** *(haqq yoldan)* ***azıb uzaqlaşmaq».*** *(İbrahim 18).* ***«O, gün nə bir insan, nə də bir cinn günahı barəsində sorğu-sual olunmayacaqdır. Günahkarlar üzlərindən tanınacaq, kəkillərindən və ayaqlarından tutulub yaxalanacaqlar».*** *(ər-Rahmən 39).* Çünki kafirin etdiyi yaxşı əməllərinin əvəzi dünyada veriləcəkdir. Qiyamət günü gələcəyi vaxt savabların yazıldığı səhifələrin bom-boş olduğunu görəcəkdir. Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kafir yaxşı bir iş gördüyü zaman onun müqabilində dünyada ikən əvəzi verilir. Möminə gəlincə şübhəsiz Allah onun həsənətlərini axirəti üçün onun lehinə saxlayır. Dünyadakı itaətinə görə isə onun ruzisini verir»[1351]. Aişə - *radıyallahu anhə* – rəvayət edir ki: "Ya Rəsulullah! İbnu Cənan cahiliyyə dönəmində qohumluq əlaqələrini möhkəmlədərdi. Bunun ona bir faydası olacaqmı?" deyə soruşdum. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Xeyr, ona faydası olmaz. Çünki o, heç bir zaman: Ya Rəbbim! Qiyamət günü günahlarımı bağışla" deməmişdir[1352]. Lakin bəzi qrup alimlər qeyd edrilər ki, kafirlərin dünyada etdikləri əməlləri onlar üçün Cəhənnəm əzabının yüngülləş-məsinə səbəb olacaqdır. Əbu Talib və s. kimi. Lakin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – şəfaəti vasitəsilə Əbu Talibin əzabının yüngülləşdirilməsi məsələsi Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in şəfaətinə xas bir istisna hal olaraq qəbul edilmişdir.

***«****(Allahın vəhdəniyyətini danan, Quranı yalan hesab edən)* ***kafirlərin əməlləri ucsuz-bucaqsız çöldəki*** *(səhradakı)* ***ilğıma bənzər ki, susuzluqda ürəyi yanan onu su bilər. Nəhayət gəlib ona yetişdiyi zaman onun heç nə olduğunu görər. O, öz əməlinin yanında ancaq Allahın cəzasını tapar. Allah da onun cəzasını*** *(layiqincə)* ***verər. Allah tezliklə haqq-hesab çəkəndir».*** *(ən-Nur 39).* ***«****(Ya Muhəmməd!)* ***De ki: «Sizə əməlləri baxımından*** *(axirətdə)* ***ən çox ziyana uğrayanlar haqqında xəbər verimmi? O, kəslər ki, onların dünyadakı zəhməti boşa getmişdir. Halbuki onlar yaxşı işlər gördüklərini zənn edirdilər».*** *(əl-Kəhf 103-104).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü cinlər və insanlar xaric olmaqla, Allah yaratdıqları heyvanlar haqqında hökm verəcəkdir. Belə ki, buynuzsuza haqsızlıq etmiş olan buynuzluya qisas tətbiq ediləcəkdir. Bu işlər tamamlanıb heç bir heyvanın digərində haqqı qalmadıqda Allah heyvanlara: «Torpaq olun!» deyə buyurar. O, vaxt kafir: «Kaş ki, mən də torpaq olardım» deyər[1353].

Buna görə də əziz və hörmətli qardaş və bacılarım gününüzü və vaxtınızı nəyə sərf etdiyinizi fikirləşin. Çünki o, günü bu haqda fikirləşmək sizə heç bir fayda verməyəcəkdir. İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü hər bir qul beş şey haqqında: ömrünü nəyə sərf etdiyini, cavanlığını necə keçirdiyini, var-dövləti necə qazanıb hara xərclədiyini və öyrəndiyi elmə necə əməl etdiyi barəsində soruşulmadıqca ayağını Rəbbinin hüzurundan çəkməyəcəkdir»[1354].

---

[1351] Müslim.
[1352] Müslim.
[1353] Beyhəqi «Basu vən Nuşur» 327, Əhməd 2/363, Tirmizi 3/4.
[1354] Musnəd 2/254, Tirmizi 2/67, əl-Albani «Səhih Hədislər Silsiləsi» 2/629, 946.

# SIRAT

Əhli Sünnə vəl Cəmaat Qiyamət günü insanların keçəcəkləri sırat körpüsünə də inanırlar. ***Sırat*** – mənа etibarı ilə geniş yol, izlənilən yol deməkdir. ***«Şübhəsiz bu mənim sıratımdır*** *(yolumdur).* ***O, halda ona uyun».*** *(əl-Ənam 153).* Allahın haqq dini olan bu sıratın üzərində doğru yeriyən bir kimsə axirətdə də o, sıratın üzərində doğru yeriyə biləcəkdir.

Sırat Cəhənnəm üzərində qurulmuşdur. Tükdən incə və qılıncdan itidir[1355]. Cənnət ilə Cəhənnəm arasındakı körpüdür. İnsanlar əməllərinə görə sıratın üzərindən keçəcəklər. Kimisi bir göz qırpımında, kimisi ildırım kimi, kimisi rahat əsən külək kimi, kimisi yürüyən at kimi, kimisi dəvə kimi, kimisi yeriyərək, kimisi qaçaraq, kimisi sürünərək, kimiləri də zəncirlərlə tutulub Cəhənnəmə salınacaqdır. Hər kəs əməlinə görə oradan keçəcəkdir. Ta ki, günahlarından və kirlərindən təmizlənənə qədər. Sıratı keçən kimsə isə Cənnətə girməyə hazır olacaqdır. Ən sondakı qarnı üzərində sürünərək keçər və: "Ya Rəbbim! Nə üçün məni süründürdün?". Allah: "Mən səni süründürmədim, əksinə əməllərin səni süründürdü" buyurar. ***«O, gün mömin kişilərin və qadınların nurunun onların önlərindən və sağ tərəfindən axıb şölə saçdığını*** *(sırat körpüsündə onlara yol göstərdiyini)* ***görəcəksən».*** *(əl-Hədid 12).* Aişə - *radıyallahu anhə* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən: ***«****(Yadda saxla! Qiyamət günü)* ***Elə bir gündür ki, yer başqa bir yerlə, göylər də başqa göylərlə əvəz olunacaq!».*** *(İbrahim 48)* - ayəsi haqqında: «O, gün insanlar harada olacaqlar, ya Rəsulallah?» deyə soruşdum. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sırat üzərində»[1356]. Ənəs - *radıyallahu anhu* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən: «Ey Allahın Rəsulu! Mənim üçün şəfaət edərsənmi?». O: «Bəli» deyə buyurdu. Mən: «(Məhşərdə) Səni harada axtarım?» dedim. O: «Məni Sırat körpüsünün yanında axtar» deyə buyurdu. Mən: «Əgər səni orada tapmasam». O: «O, zaman məni Kövsər bulağının yanında axtar» deyə buyurdu. Mən: «Əgər səni orada da tapmasam?» dedim. O: «O, zaman məni tərəzinin yanında axtar. Çünki Qiyamət günü mən bu üç yerdən birinin yanında olacağam»[1357]. Aişə - *radıyallahu anhə* – deyir ki, atəşi xatırlayıb ağladım. Peyğəmbər: "Nə üçün ağlayırsan? (səni ağladan nədir?)" deyə soruşdu. Mən: "Cəhənnəmi xatırlayıb ağladım. Qiyamət günü ailənizi xatırlayacaq-sınızmı?" deyə soruşdum. Peyğəmbər: "Üç yerdə kimsə kimsəni xatırla-maz: Mizan yanında – hesabı ağırmı, yüngülmü gəldi – öyrənincəyə qədər. Əməl dəftərinin verildiyi zaman, yəni kitabının sağınamı, solunamı, yoxsa arxasınamı qoyulacağını bilənə qədər. Sırat (körpüsü) Cəhənnəmin üstünə qurulduğu (və oradan) keçildiyi zaman, iki tərəfdən tikanlar, qırmaqlar və Allah onlarla istədiyi məxluqu tutduğu zaman, kimin qurtulub, kimin də qurtulmadığı aydın olduğu zaman"[1358]. Ənəs - *radıyallahu anhu* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Sırat ülgüc və ya qılınc kimi itidir, mələklər mömin kişi və qadınları qurtarırlar (kömək edirlər). Cəbrail - *əleyhissəlam* - qarşımı kəsər mən də: "Ya Rəbbim, qurtar, qurtar, o gün çox kişi və qadın ora düşər".

---

[1355] Müslim.
[1356] Müslim.
[1357] Tirmizi "Qiyamət" 10, 2435, Əhməd 3/178.
[1358] Əbu Davud "Sünən" 28, 4755.

İman və əməllərə görə onlara nur verilir. Atəşdən gələn qırmaqlar günahlara görə qaparlar. Münafiqlər dünyada möminlərlə olduqları kimi, axirətdə də möminlərlə birlikdə onlara nur veriləcəkdir. Lakin körpüyə çatdıqda onların nuru sönər. Utbə b. Yəkzandan gələn rəvayətdə İbn Abbas - *radıyallahu anhu* – deyir ki: ***"Ey iman gətirənlər! Allaha səmimi-qəlbdən (****bir daha günaha qayıtmamaq şərtilə)* ***tövbə edin. Ola bilsin ki, Rəbbiniz günahlarınızın üstünü örtsün və sizi*** *(ağacları)* ***altından çaylar axan cənnətlərə daxil etsin. O gün Allah Öz Peyğəmbərini və onunla birlikdə iman gətirənləri xəcil etməz. Onların*** *(iman)* ***nuru*** *(qıl körpüsü üstündə onlara yol göstərmək üçün)* ***önlərindən və sağ tərəflərindən axıb şölə saçarkən onlar belə deyəcəklər: "Ey Rəbbimiz! Bizim nurumuzu tamam-kamal elə və bizi bağışla. Həqiqətən, Sən hər şeyə qadirsən!".*** *(ət-Təhrim 8).* Sırat üzərində möminin nuru yanmağa davam edər, lakin münafiqin nuru isə sönər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kim mömin haqqında bilmədiyi bir şey söyləyərsə (onu pisləmək üçün iftira atarsa) Allah dediyindən dönənə qədər onu Cəhənnəm körpüsü üzərində həps edər"[1359].

Reşideyn b. Səid, Amr b. Həris yolu ilə Səid b. Əbu Həllalın belə dediyini rəvayət edir: "Bizə çatan xəbərlərə görə Sırat bəzi insanlar üçün tükdən daha incə olur, bəzi insanlar üçün geniş bir vadi olur". Səhl əl-Tustari – *rahmətullahi aleyhi* - deyir ki: "Kimin dünyada olan Sıratı dar olursa, Qiyamət günü geniş olur". Yəni: Kim Allahın əmirlərinə itaət edib günahlardan da uzaq olaraq çətin olanı seçərsə dünyada Sıratal Mustəqim üzərədir və bunun qarşılığı da Qiyamət günü Sırat onun üçün genişlənir. Yenə hər kim dünyada şəhvətinə tabe olub günah edər və zəlalətə aparan şübhələrə tabe olaraq yolunu genişləndirərsə Sıratal Mustəqimdən çıxmışdır və buna görə də Qiyamət günü Sırat onun üçün dar olacaqdır. Allah daha doğru bilir. Sələflər bir kimsənin güldüyünü gördükdə ona: "Səni güldürən nədir? Cəhənnəmi arxada qoymadığın müddətdə xoşbəxtçilikdən əmin olmazsan". Muaz b. Cəbəl - *radıyallahu anhu* – dan "Mərfu" olaraq rəvayət edilir ki: "Mömin Cəhənnəm körpüsünü keçib onu arxada buraxmadığı müddətdə qorxusu və həyəcanı keçməz"[1360].

Sıratı keçdikdən sonra Cənnət ilə Cəhənnəm arasındaki bir körpüdə dayandırılırlar və birinin o biri üzərindəki haqqı qisas yolu ilə alınır. Nəhayət tərtəmiz edildikdən sonra Cənnətə girmək üçün onlara izn verilir. Əbu Səid - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Möminlər Cəhənnəmdən qurtulub Cənnətlə Cəhənnəm arasında körpüdə bir müddət həps edilirlər. Bu yerdə aralarında dünyada olan keçmiş haqsıqlıqlar qisas edilir. Beləcə günahlardan təmizlənib paklandıqdan sonra Cənnətə girmələrinə izin verilir. Nəfsim əlində olan Allaha and olsun ki, onlardan hər biri Cənnətdəki evini, dünyadakı evindən daha yaxşı bilir"[1361].

# HOVUZ

Əhli Sünnə vəl Cəmaat Qiyamət günü Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in hovuzunun ***Havdul-Məvrudun*** olduğuna da inanırlar. Bu hovuzun suyu süddən daha ağ, baldan daha şirindir. İyi miskdən gözəldir, ətrafındakı qədəhlərin sayı göydəki

---

[1359] Əbu Davud.
[1360] İbn Əbu Hatim "Mursəl" hədis.
[1361] Buxari "Məzalim" 1, 5/96, "Riqaq" 48.

ulduzlar qədərdir. Eni bir aylıq, uzunluğu da bir aylıq gedilən məsafa qədərdir. Ondan bir dəfə içən bir daha əbədiyyən susamaz. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Mənim hovuzum bir aylıq məsafə qədərdir. Suyu süddən ağdır, iyi miskdən gözəldir. Qədəhlərinin sayı göydəki ulduzlar qədərdir. Ondan bir dəfə içən bir daha əbədiyyən susamaz. Ona biri qızıl, digəri gümüş olmaq üzərə iki boru ilə Cənnətdən su axır»[1362]. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Hövuzun iki ucu arasındakı məsafə Mədinə ilə Sana və Mədinə ilə Amman arasındakı məsafə qədərdir (Başqa rəvayətdə: «Hövuzun böyüklüyü Amman ilə Yəmən arası qədərdir»)»[1363]. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Mən hövuzun yanına çatan ilk insanam»[1364]. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Mən sizdən öncə hövuzun başına gələcəyəm. Mən sizin şahidiniz olacağam. Allaha and olsun ki, mən indi də hövuzuma baxmaqdayam. Mənə xəzinələrin açarları verildi. Mən sizin Allaha şərik qoşmağınıza görə qorxmuram. Lakin dünyanı əldə etmək üçün yarışma-ğınızdan və bu minvalla sizdən əvvəlkilərin məhv olduqları kimi sizin məhv olmağınızdan qorxuram»[1365]. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Evimlə minbərin arası Cənnət baxçalarından bir baxçadır. Minbərimdə hövuzumun üzərindədir»[1366].

Lakin dində yeniliklər etmişlər o, dəhşətli istidə bundan məhrum olacaqlar. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – buyurdu: «Sizdən hovuza ilk gələn mən olacağam. Mənim yanıma gələcək olan oradan içəcək, oradan bir dəfə içən əbədiyyən susamayacaqdır. Mənim yanıma mənim tanıdıqlarım, onların da məni tanıdıqları bir qism insanlar gələcəklər. Mənimlə onların arasında əngəl qoyulacaqdır». Başqa rəvayətdə: «Onlar məndəndirlər» deyəcəyəm. Mənə: «Sən onların səndən sonra nələr uydurub ortaya çıxartığını bilmirsən». Bu dəfə mən də: «Məndən sonra dəyişikliklər ortaya çıxaranlar məndən uzaq olsunlar, məndən uzaq olsunlar. (Başqa rəvayətdə: «Ey Allahın Rəsulu! O, gün bizi tanıya biləcəksən?» deyə soruşdular. Peyğəmbər: «Sizin başqa ümmətlərdə olmayan bir əlamətiniz olacaqdır. O, vaxt sizlər (dünya da ikən almış olduğunuz) dəstəmazın əsəri olaraq üzünüz, əlləriniz və ayaqlarınız işıq saçar halda yanıma gələcəksiniz»)»[1367].

***Hovuzun Xüsusiyətləri***:

**1.** Uzunluğu bir ay gedilən məsafə qədərdir. **2.** Eni bir ay gedilən məsafə qədərdir. **3.** Dördbucaqlı şəklindədir. **4.** Suyu baldan şirindir. **5.** Süddən ağdır. **6.** Buzdan soyuqdur. **7.** Bir dəfə içən əbədiyyən susamaz. **8.** Qədəhlərin sayı ulduzların sayı qədərdir. **9.** İyi misqdən gözəldir. **10.** Ona axan su Cənnətdəki Kövsər bulağından bir qızıl və bir gümüş boru ilə axır. Bəzi rəvayətlərdə hər bir Peyğəmbərin öz hovuzu olduğu da qeyd edilir. Peyğəmbər – *sallallahu aleyhi və salləm* – ə onlardan fərqli olaraq Cənnətdə Kövsər bulağı da veriləcəkdir. Kövsər – bol nemətlər deməkdir.

Hovuz ilə Kövsərin fərqi.

**1.** Hovuz məşhərdə olacaq, Kövsər isə Cənnətdə. **2.** Hovuzun ləfzi Quranda varid olmayıb, Kövsər haqqında isə Quranda surə vardır. **3.** Kövsər hovuzdan böyükdür. **4.** Kövsər əslidir, hovuz isə qoludur. **5.** Kövsər yalnız Peyğəmbər – *sallallahu aleyhi və salləm* – ə verilib, hovuz isə bütün peyğəmbərlərə: ***«Həqiqətən biz sənə Kövsəri bəxş***

---

[1362] Buxari, Müslim.
[1363] Müslim «Fəzail» 2/41, İbn Məcə «Zuhd» 2/36.
[1364] Buxari «Fitən» 1/8, Müslim 2/1793.
[1365] Buxari 2/94, Müslim 2/31.
[1366] Buxari «Rikak» 7/208.
[1367] Buxari, Müslim «Təharət» 1/36.

***etdik».*** *(əl-Kövsər 1).* Səmura - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər bir Peyğəmbərin hovuzu vardır. Onlar hansının hovuzundan daha çox insan su içmək üçün gəldiyi barədə bir-birləri ilə iftixar edərlər. Su içmək üçün insanların saylarının ən çox olduğu hovuzun mənim olacağına ümüd edirəm»[1368]. Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Mən Cənnətdə yürüdüyüm zaman bir çay gördüm. İki tərəfində incidən oyulmuş qübbələr vardır. Mən: «Ya Cəbrail! Bu nədir?» deyə soruşdum. Cəbrail: «Bu çay Rəbbinin sənə verdiyi kövsərdir» deyə cavab verdi. Mən gördüm ki, onun torpağı təmiz və iyi misk idi»[1369]. Lakin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in hovuzu ən böyük, ən şirin və su içmək üçün insanların saylarının ən çox olduğu hovuzdur. Allah bizi də onlardan etsin. Amin!

## CƏNNƏT VƏ CƏHƏNNƏM

Əhli Sünnə vəl Cəmaat Cənnət və Cəhənnəmin insanların əbədiyyən qalmaq üçün girəcəkləri yer olduqlarına inanırlar. Cənnət və Cəhənnəm yaradılmışdır. İndi də vardır. Əbədiyyən yox olmazlar. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – gecə namazına qaxdıqda bu duanı deyərdi: «Həmd yalnız sənədir. Haqq olan sənsən. Sənin vədin də haqdır. Sənə qovuşmaq da haqdır. Sözün də haqdır. Cənnət də haqdır. Cəhənnəm atəşi də haqdır. Bütün Peyğəmbərlər də haqdır. Muhəmməd də haqdır. Qiyamət də haqdır»[1370]. Ubadə b. Samit – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Kim şəhadət etsə ki, Allahdan başqa haqq ilah yoxdur, Muhəmməd onun qulu və Rəsuludur, İsa – *əleyhissəlam* - onun qulu və Rəsuludur, Məryəmə dediyi söz və Ondan gəlmə bir ruhdur, Cənnət haqq, Cəhənnəm haqqdır, Allah o insanı əməlindən asılı olaraq (və ya olmayaraq) Cənnətə salar (Başqa rəvayətdə: Cənnətin hansı qapısından istərsə, onu oradan içəri salar!)»[1371].

Cənnət əbədi nemətlər yurdudur. Allah oranı iman edilməsi fərz olan şeylərə iman edən, Allah və Rəsuluna itaət edən, bunu da Allaha ixlas ilə və Rəsuluna tabe olaraq gerçəkləşdirən təqva sahibi olan möminlər üçün hazırlamışdır. Orada olan nemətləri nə bir göz görmüş, nə bir qulaq eşitmiş, nə də bir insanın xatirindən keçmişdir. ***«İman gətirib yaxşı əməllər edənlər isə yaradılmışların ən yaxşılarıdır. Onların öz Rəbbi yanındakı mükafatı*** *(ağacları)* ***altından çaylar axan Ədn Cənnətləridir. Onlar orada əbədi qalacaqlar».*** *(əl-Bəyyinə 7-8).* ***«Etdikləri əməllərin mükafatı olaraq*** *(Allah dərgahında)* ***möminlər üçün göz oxşayan nə cür nemətlər gizlənib saxlandığını heç kəs bilməz».*** *(əs-Səcdə 17).* Ənəs b. Məlik – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Qiyamət günü Cənnət əhlindən olub dünyada ən çətin və məşəqqətli həyat sürən birisi gətirilir və Cənnətə bir dəfə salınıb çıxardılır». Ona: «Ey Adəm oğlu! Sən dünyada ikən heç çətinlik və sıxıntı gördünmü?» O, da: «Xeyr, ya Rəbbim! Mən heç bir həyat çətinliyi və sıxıntısı görmədim!»[1372].

---

[1368] Buxari "Tarix" 1/44, İbn Əbi Asim «Sünnə» 734, Təbərani «Mucəmul Kəbir» 7/656, Tirmizi «Sifətul Qiyəmə», əl-Albani «Səhih Hədislər Silsiləsi» 1589.
[1369] Buxari 11/464.
[1370] Buxari, Müslim.
[1371] Buxari, Müslim.
[1372] Müslim 2807.

Cəhənnəm isə Allahı inkar edib, Rəsuluna baş qaldıran kafirlər, münafiqlər, müşriklər, günahkarlar və zalımlər üçün hazırlanmışdır. Günahkarların atəşi əbədi deyildir. Kafirlərin atəşi isə əbədi olaraq sönməz. Orada ağıla gəlməyən cəzalar və əzablar vardır. ***De ki: «Haqq Rəbbinizdəndir. Kim istəyir inansın, kim də istəyir inanmasın*** *(kafir olsun).* ***Biz zalimlər üçün elə bir atəş hazırlamışıq ki, onun pərdələri*** *(dumanları)* ***onları bürüyəcəkdir. Onlar imdad istədikdə onlara qətran*** *(yaxud yaradan axan irin-qan)* ***kimi üzlərini büryan edən bir su ilə kömək ediləcəkdir. O, nə pis içki, o Cəhənnəm necə də pis məskəndir».*** *(əl-Kəhf 29).* Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cəhənnəm əhli, cəhənnəmliklərə gəlincə isə onlar orada nə ölürlər, nə də həyat tapırlar. Lakin günahları – *xətaları* – səbəbiylə atəşə düşən bir qrup kimsələr vardır ki, atəş onları təmamilə yandırıb (kül) edər. Yanıb kömür olduqdan sonra onlara şəfaət edilmə izni verilir. Beləcə qrup-qrup çıxarılıb Cənnət çaylarına atılırlar. Sonra: "Ey Cənnət əhli! Bunların üzərinə su tökün" deyilir. Onlar sel yatağında bitən yabanı ot kimi yenidən bitərlər"[1373]. Ənəs b. Məlik – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Qiyamət günü Cəhənnəm əhlindən olub dünyada ən nemətli və gözəl yaşayan birisi gətirilib Cəhənnəmə bir dəfə salınıb çıxardılır». Ona: «Ey Adəm oğlu! Sən heç dünyada ikən bir xeyir gördünmü?» O, da: «Xeyr, ya Rəbbim! Heç bir xeyir görmədim»[1374]. ***«Əgər zül etmiş bir şəxs yer üzündə olan hər şeyə sahib olsaydı, onu*** *(Allahın əzabından qurtarmaq üçün)* ***fidyə verərdi. Onlar əzabı gördükləri zaman için-için peşman olarlar».*** *(Yunus 54).* Ənəs b. Məlik – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Qiyamət günü Uca və Böyük olan Allah Cəhənnəmiklərdən ən yüngül əzab olunana: «Dünya və dünyadakı hər şey sənin olsaydı bu əzabdan qurtarmaq üçün onu sədəqə verərdinmi?» O, da: «Bəli, sədəqə verərdim» deyəcəkdir. Allah ona: «Mən səni atəşə atmayacaqdım. Dünyada ikən səndən bundan da yüngülünü istəmişdim. Mənə şərik qoşmamağını. Lakin sən dünyaya gəldikdə (Allaha ibadət etməkdən) imtina etdin və şirkdən uzaq olmadın»[1375].

Əhli Sünnə Muhəmməd – *sallallahu aleyhi və səlləm* – in Cənnətə ilk girəcəyinə, həmçinin onun ümmətinin ilk hesaba çəkiləcəyinə və Cənnətliklərin yarısından çoxunun onun ümmətinin təşkil edəcəyinə iman edirlər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günündə Cənnətin qapısına gələcəyəm və qapının açılmasını istəyəcəyəm». Mənə: «Sən kimsən?» deyə soruşacaqlar. Mən də: «Muhəmməd!» deyəcəyəm. O, da: «Mənə sənin adın verildi. Səndən əvvəl heç kəs üçün qapını açmamaqla əmr olundum»[1376]. Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: "Qiyamət günü cəmaatı ən çox olan kimsə mənəm. Cənnət qapısını ilk döyən də mənəm"[1377]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnətdə yüz dərəcə vardır. Allah oranı yolunda vuruşan mücahidlər üçün hazırlamışdır. Hər iki dərəcə arasında yerlə göy arası qədər məsafə vardır. Allahdan dilədikdə Firdovsu diləyin. O, Cənnətin orta yerində ən üst yerdədir. Onun üstündə Rahmənin Ərşi vardır.

---

[1373] Müslim "İman" 306, (185).
[1374] Müslim "Munafiqun" 2807.
[1375] Buxari "Rikak" 51, 49, Müslim 2805.
[1376] Müslim 197.
[1377] Müslim 196.

Cənnətin çayları oradan qaynayır» . Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: “Cənnətdə Allahın yolunda vuruşanlar üçün hazırlanmış **100** dərəcə vardır. Hər iki dərəcə arası göylə yer arası qədərdir”[1379]. Bureydə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnət əhli **120** səffdir. Bu səfflərdən **80** bu ümmətdən, **40** isə digər ümmətlərdən olacaqdır»[1380]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Bizlər (dünyaya) ən sonda gələnlərik, Qiyamət günü isə ən öndə olanlarıq (Başqa rəvayətdə: Biz Cənnətə ilk girənlərik. (Kitab Əhlinə) kitab bizdən öncə verilmiş, bizə isə sonra verilmişdir. Onlar ixtilaf etdilər. Allah bizi onların ixtilaf etdikləri haqqa izni ilə hidayət etdi[1381])»[1382]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki: ***“(Onların) bir çoxu əvvəlkilərdən** (keçmiş peyğəmbərlərin ümmətlərindən)**, Bir çoxu da axırıncılardandır** (bu ümmətdəndir)**”.** (əl-Vaqiə 39-40).* Ayəsi nazil olduqda Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: “Siz Cənnət əhlinin **4/1**-siz. Siz Cənnət əhlinin **3/1-**siz. Siz Cənnət əhlinin yarısısınız...”[1383]. İbn Abbas – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Biz (düyaya gəlməkdə) ümmətlərin ən sonuncusuyuq. Eyni zamanda hesabları hər kəsdən öncə çəkilənlərik»[1384]. Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: “Cənnət – mən girənə qədər digər Peyğəmbərlərə, Ümmətim girənə qədər digər ümmətlərə haramdır”[1385].

Bu ümmət yerdən ilk öncə çıxacaq olan ümmətdir, məhşərdə ən yüksək yerə ilk duran ümmətdir, Ərşin gölgəsinə ilk öncə gələn ümmətdir, aralarında hesabları ilk çəkiləcək olan ümmətdir, sıratı ilk keçən ümmətdir, Cənnətə də ilk girən ümmətdir, Cənnət – Muhəmməd - *sallallahu aleyhi və səlləm* - girənə qədər digər Peyğəmbərlərə, ümməti girənə qədər digər ümmətlərə haramdır. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: “Mənim yanıma Cəbrail - *əleyhissəlam* - gəlib əlimdən tutdu və ümmətimin girəcəyi qapını göstərdi. Əbu Bəkr: “Ya Rəsulullah! İstərdim səninlə bərabər olum”. Peyğəmbər: “Ey Əbu Bəkr! Ümmətimdən Cənnətə ilk olaraq girən kişi sənsən” deyə buyurdu[1386].

***Cənnət Və Cəhənnəmin Mövcud Olması:*** Əhli Sünnə Cənnət və Cəhənnəmin yaradılmış olduqlarına və indi də var olduqlarına inanırlar. ***«Rəbbinizin məğfirətinə və genişliyi göylər və yer üzü qədər olan, müttəqilər üçün hazırlanmış Cənnətə tələsin».*** *(Ali-İmran 133). «(Ey insanlar!)* ***Rəbbiniz tərəfindən bağışlanmağa və göycə, yercə geniş olub, Allaha və onun peyğəmbərinə iman gətirənlərdən ötrü hazırlanmış Cənnətə nail olmaq üçün bir-birinizdən qabağa düşməyə çalışın. Bu Allahın dilədiyi kimsəyə əta etdiyi lütf, mərhəmətidir. Allah çox böyük mərhəmət, kərəm sahibidir».*** *(əl-Hədid 21).* ***And olsun ki,*** *(Muhəmməd əleyhissəlam Cəbraili öz həqiqi surətində)* ***başqa bir dəfə də*** *(merac vaxtı)* ***görmüşdü;*** *(Yeddinci göydəki)* ***Sidrətül-müntəhanın yanında.*** *(Mələklər, şəhidlər və müttəqilər məskəni olan)* ***Məva cənnəti onun yanındadır”.*** *(ən-Nəcm 13-15).* Aişə – *radıyallahu anhə* – rəvayət edir ki, günəş

---

[1378] Buxari 6987, Tirmizi 2530, əl-Albani "Səhih".
[1379] Buxari 6/11, Hakim 1/80, Əhməd 2/335, 5/321.
[1380] Tirmizi 2670, Əhməd 1/453, İbn Əbi şeybə “Musənnəf” 11/471, Təhavi “Muşkil” 1/157.
[1381] Müslim 855.
[1382] Buxari «Cumə» 1/1.
[1383] İbn Kəsir 1/404, Mücmuaz Zəvaid 10/403, Əhməd 3/383.
[1384] İbn Məcə «Zuhd».
[1385] Daraqutni “əl-Əfrad”, İbn Kəsir 1/404.
[1386] Əbu Davud 4652.

tutuldu. Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «…Mən vəd olunduğunuz hər şeyi gördüm. Hətta irəliyə doğru getməyə başladığımı gördüyünüz vaxt Cənnətdən bir salxım almaq istədim (Başaqa rəvayətdə: Əgər o, salxımı dərə bilsəydim dünya durduqca ondan yeyərdiniz (heç qurtarmazdı). Məni geriyə çəkildiyimi gördüyünüz vaxt Cəhənnəmi gördüm. Bu gün kimi ömrümdə qorxulu bir mənzərə görməmişdim…» [1387]. Abdullah b. Amr – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Muhəmmədin canı əlində olan Allaha and olsun ki, Cənnət o qədər yaxınlaşdı, o qədər yaxınlaşdı ki, əlimi açsaydım meyvələri (yemişləri) əlimə gələrdi. Cəhənnəm də o, dərəcədə yaxınlaşdı ki, ondan sizə də zərər gələr qorxusuyla qorunmağa başladım"[1388]. Ənəs b. Məlik – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* – bizimlə namaz qılarkən buyurdu: «Ey insanlar! Mən sizin imamınızam. Məndən öncə rukuya və səcdəyə getməyin, başlarınızı qaldırmayın. Çünki mən sizi önümdən və arxamdan görürəm. Canım əlində olana and olsun ki, mənim gördüyümü görsəydiniz az gülər, çox ağlayardınız". Onlar: "Nə gördün Ya Rəsulullah!" dedilər. Peyğəmbər: "Cənnəti və Cəhənnəmi" deyə buyurdu[1389].

Həmçinin Adəm – *əleyhissəlam* – və zövcəsinə qadağan olunmuş ağacdan yeməkləri, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Merac səfərində Cənnəti və Cəhənnəmi görməsi onların olduğuna dəlalət edir. Cəhənnəm haqqında: ***«Kafirlər üçün hazırlanmış oddan həzər edin».*** *(Ali-İmran 131).* ***«Həqiqətən Cəhənnəm pusqudur. O, azğınların məskənidir».*** *(ən-Nəbə 21-22).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mənə Cənnət göstərildi və oranın əhalisinin çox hissəsini fəqirlərin olduğunu gördüm. Mənə Cəhənnəm göstərildi və oranın əhalisinin çoxunun qadınlar olduğunu gördüm» [1390]. İbn Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Sizdən hər hansı bir kimsə öldükdən sonra səhər-axşam ona qalacağı yer göstərilir. Cənnət əhlindəndirsə Cənnət, Cəhənnəm əhlindəndirsə Cəhənnəm əhli arasındakı yeri göstərilir və ona: Qiyamət günü Allah səni ora göndərincəyə qədər sənin yerin budur» deyilir[1391]. Kəb b. Məlik – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Möminin canı Cənnət ağaclarına qonan bir quşdur. Ta ki, Uca Allah Qiyamət günündə onu təkrar cəsədinə geri göndərincəyə qədər»[1392]. İbn Məsud – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «İsraya getdiyim gecə İbrahim – *əlehissəlam* – ilə görüşdüm. Mənə: «Ey Muhəmməd! Ümmətinə məndən salam söylə və onlara xəbər ver ki, Cənnətin torpağı xoş, suyu gözəl və ora dümdüz bir ərazidir. Orada əkiləcək ağaclar isə: «***Subhənəllai və Bihəmdihi, və Lə İləhə İlləllahu, Vallahu Əkbər***» sözləridir» [1393]. Rəsulullah - *səllallahu aleyhi və səlləm* - buyurdu: «Kim ***Subhənəllahil Azimi və Bihəmdihi***» deyərsə onun üçün Cənnətdə bir xurma ağacı əkilər»[1394].

Əhli Sünnə Cənnət və Cəhənnəmin əbədiyyən yox olmayacaqlarına da inanırlar. Allah Cənnəti və Cəhənnəmi, yaratdıqlarını yaratmadan əvvəl var etmişdir. Hər iksinə

---

[1387] Buxari 1212, Müsllim 901.
[1388] Əhməd 2/159, Əbu Davud 1194, Nəsəi 3/138.
[1389] Müslim 426.
[1390] Buxari, Müslim.
[1391] Buxari, Müslim 5110.
[1392] Muvatta 1/240, Tirmizi 1641, Nəsəi 4/108, İbn Məcə 1449, Musnəd 3/455,456, 6/386.
[1393] Tirmizi 3458.
[1394] Səhih Tirmizi 3/160, Həkim 1/501, əl-Albani «Səhihul Cəmi» 5/531.

girəcək insanları da, cinləri də O, yaratmışdır. Cənnət əhli, Cənnət əhlinin əməllərini edərək ölürlər. Cəhənnəm əhli isə Cəhənnəm əhlinin əməlləri ilə əməl edərək ölürlər. Cənnət əhli Allahın lütfü ilə Cənnətə, Cəhənnəm əhli isə Allahın ədaləti ilə Cəhənnəmə girərlər. *«(İslamı)* ***ilk əvvəl qəbul edib*** *(başqalarını bu işdə)* ***qabaqlayan mühacirlərə və ənsara, həmçinin yaxşı işlər görməkdə onların ardınca gedən kimsələrə gəldikdə, Allah onlardan, onlar da Allahdan razıdırlar. Allah onlar üçün əbədi qalacaqlar, altından çaylar axan Cənnətlər hazırlamışdır. Bu ən böyük qurtuluş və uğurdur».*** *(ət-Tövbə 100).* ***«Xoşbəxt olanlar isə, Rəbbinin dilədiyindən əlavə, tükənməz bir nemət kimi göylər və yer durduqca Cənnətdə əbədi qalacaqlar».*** *(Hud 108).* ***«Onlara Cənnətdə heç bir yorğunluq üz verməz. Onlar oradan çıxan da deyillər».*** *(əl-Hicr 48).* ***Bu əlbətdə bizim ruzimizdir. O, bitməz-tükənməzdir».*** *(Sad 54)* və s. ayələrdə Allah həm Cənnətin əbədiliyini, həm də oradakıların həyatının əbədi olduqlarını, həyatlarının əsla bitməyəcəklərini və oradan çıxarılmayacaqlarını bildirir. ***«Onlar orada ilk ölümdən başqa bir ölüm dadmayacaqlar».*** *(əd-Duxan 56).*

Cəhənnəm haqqında isə: ***«Kafirləri və zülmkarları, şübhəsiz ki, Allah bağışlayan və onlara Cəhənnəm yolundan başqa bir yol göstərən deyildir. Onlar orada əbədi qalacaqlar. Bu isə Allah üçün çox asandır!».*** *(ən-Nisa 169).* ***«Kim Rəbbinin hüzuruna günahkar kimi gələrsə, onu Cəhənnəm əzabı gözləyir. O, Cəhənnəmdə nə ölər, nə də yaşayar».*** *(Ta ha 74).* ***«Şübhəsiz ki, Allah kafirlərə lənət eləmiş və onlar üçün yanar od hazırlamışdır. Onlar orada əbədi qalacaqlar, nə bir hami, nə də bir mədədkar tapa biləcəklər».*** *(əl-Əhzab 64-65).* ***«Kafir olanları Cəhənnəm odu gözləyir.*** *(Orada)* ***nə onların ölmünə hökm olunar ki, ölüb canları qurtarsın, nə də əzabları yüngülləşər. Biz hər bir kafiri belə cəzalandırırıq».*** *(Fatir 36).* ***«Onların bu əzabı yüngülləşdiril-məyəcəkdir. Onlar orada əllərini hər şeydən üzmüş olacaqlar!».*** *(əz-Zuxruf 75)* və s. ayələrdə Cəhənnəmin, cəhənnəm əhli üçün yaradıldığını, onların orada əbədi qalacaqları bildirilir.

## CƏHƏNNƏMİN VƏSFİ

***«Ey iman gətirənlər! Özünüzü və əhli-əyalınızı elə bir oddan qoruyun ki, onun yanacağı insanlar və daşlar, xidmətçiləri isə Allahın onlara verdiyi əmrlərə asi olmayan buyurduqlarını yerinə yetirən daş qəlbli və çox sərt təbiətli mələklərdir».*** *(ət-Təhrim 6).* ***«…Onlar Cəhənnəm odunun yanacağıdırlar».*** *(Ali İmaran 10).* ***«O, gün biz Cəhənnəmi kafirlərin gözü qarşısına gətirərik».*** *(əl-Kəhf 100).* ***«****(Ey müşriklər! Qiyamət günü)* ***Siz o, Cəhənnəmi mütləq görəcəksiniz! Bəli siz onu mütləq öz gözünüzlə görəcəksiniz!».*** *(ət-Təkəsur 6.7).* ***«Onların üstlərində və altlarında oddan sipər vardır. Allah öz bəndələrini bununla qorxudur. Ey bəndələrim! Məndən qorxun».*** *(əz-Zumər 16).* ***«Onları zillət basar…Onların üzü sanki gecənin zülmət parçaları ilə örtülmüşdür. Onlar Cəhənnəmlikdirlər. Özləri də orada əbədi qalacaqlar».*** *(Yunus 27).* ***«Əməl dəftəri sol əlinə verilən isə deyəcəkdir: «Kaş əməl dəftərim mənə verilməyəydi! Hesabımın da nə olduğunu bilməyəydim! Kaş o,*** *(ölüm)* ***qəti*** *(əbədi)* ***olaydı! Mal dövlətim mənə heç bir fayda vermədi».*** *(əl-Haqqa 25-29).* ***«Onlar deyəcəklər: «Ey Rəbbimiz! Sən bizi iki dəfə öldürüb iki dəfə diriltdin. Biz öz günahlarımızı etiraf etdik. İndi çıxmağa bir yol varmıdır!*** *(Onlara)* ***Bu ona görədir ki,*** *(dünyada)* ***yalnız Allah çağrıldığı zaman inkar edir, Ona şərik qoşulduqda isə inanırdınız. İndi isə hökm uca, böyük olan Allahındır!».*** *(əl-Mumin 11.12).* ***«İnsanları onlara əzab gələcəyi günlə qorxut. O, gün zalimlər: «Ey Rəbbimiz! Bizə***

***bir az möhlət ver. Biz sənin dəvətini qəbul edər və Peyğəmbərlərə tabe olarıq» – deyərlər. Bəs əvvəlcə sizə heç bir zaval toxunmayacağı barədə and içməmişdiniz».*** *(İbrahim 44).* ***«Onlar orada fəryad edib deyəcəklər: «Ey Rəbbimiz! Bizi buradan çıxart ki, saleh əməllər edək. O, əməlləri yox ki,*** *(dünyada)* ***edirdik!*** *(onlara)* ***Məgər sizə orada öyüd-nəsihət qəbul edəcək kimsənin öyüd-nəsihət qəbul edəcəyi qədər ömür vermədikmi? Hələ sizə qorxudan Peyğəmbərlər də gəlmişdir. Dadın*** *(Cəhənnəm əzabını)!* ***Zalimlərin imdadına çatan olmaz!».*** *(Fatir 37).* ***«Onlar deyərlər: «Ey Rəbbimiz! Rəzil taleyimiz bizə qələbə çaldı və biz haqq yoldan azan bir camaat olduq! Ey Rəbbimiz bizi oradan*** *(Cəhənnəm odundan)* ***çıxart! Əgər bir də*** *(pis işlərə)* ***qayıtsaq, şübhəsiz ki, zalim olarıq».*** *(əl-Muminun 106-108).* ***«Sizdən elə bir kəs olmaz ki, Cəhənnəmə varid olmasın. Bu Rəbbinin buyurduğu vacib bir hökmdür».*** *(Məryəm 71).* Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnət və Cəhənnəm aralarında münaqişə etdilər. Cənnət deyir: «Mənə daxil olanlar zəif və miskinlərdir. Cəhənnəm deyir: «Mənə daxil olanlar qüvvətlilər və təkəbbürlülərdir». Allah Cəhənnəmə: «Sən mənim əzabımsan. İstədiyimdən sənin ilə intiqam alaram». Cənnətə isə: «Sən Mənim rəhmətimsən. Sənin ilə istədiyim kəsə rəhm edərəm. İkinizə də dolduracaq qədər vardır»[1395]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cəhənnəm əhlindən iki sinif insan var ki, mən onları dünyada ikən görməmişdim. Bir qövm inəyin quyruğu kimi qamçılarla insanları döyərlər. İkincisi isə qadınlar açıq-saçıq, yarım çılpaq geyinəcəklər, pozğun şeylərə meyl edəcəklər, başlarını (saçlarını) dəvənin boynundakı hörüklər kimi maili çıxacaqlar. Onlar Cənnətə daxil olmazlar və onun iyisini də duymazlar. Halbuki cənnətin iyi bu və bu qədər məsafədən hiss edilir»[1396]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *səllallahu aleyhi və səlləm* - buyurdu: «Əgər kafir Allahın yanındakı rəhmətini bilsəydi Cənnətdən ümüd kəsməzdi. Əgər mömin Allah yanındakı əzabdan xəbərdar olsaydı Allahın Cəhənnəmindən əmin olmazdı»[1397]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «….Allah Cənnətə sən mənim rəhmətimsən, mən səninlə qullarımdan istədiyimə rəhmət edirəm». Cəhənnəmə də: «Sən mənim əzabımsan. Mən səninlə qullarımdan istədiyimə əzab edirəm. Hər birinizə dolusu qədər var. Amma Cəhənnəm dolmaq bilməz. Nəhayət Allah ayağını onun üzərinə qoyar, o da: Bəsdi, Bəsdi! deyib Cəhənnəm dolar. (Cəhənnəmi doldurmaqla) Allah heç bir kəsə zülm etməz. Cənnətə gəlincə Allah onun boşluqlarını doldurmaq üçün bir neçə varlılıqlar yaradır»[1398]. Adıy b. Hatim – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Sizdən elə bir kimsə yoxdur ki, onunla Allah arasında heç bir vasitə olmadan Allah onunla danışmasın. Sağına baxacaq etdiyi əməlindən başqa bir şey görməyəcəkdir, soluna baxacaq etdiyi əməlindən başqa bir şey görməyəcəkdir. Önünə baxacaq önündə Cəhənnəmdən başqa bir görməyəcəkdir. Bir xurmanın yarısı qədər də olsa sədəqə verərək və ya gözəl bir söz söyləyərək özünüzü Cəhənnəm əzabından qoruyun"[1399].

---

[1395] Müslim 5081, Səhihul Cəmi 183.
[1396] "Səhihul Cəmi" 3693.
[1397] Buxari 7/83 «Rikak» 20.
[1398] Buxari, Müslim 5084.
[1399] Buxari, Müslim.

***Cəhənnəmin Böyüklüyü:*** İbn Məsud – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «O, gün Cəhənnəm gətrilir. Cəhənnəmin yetmiş min yuları olacaqdır və hər bir yularında yetmiş min mələk tutacaqdır. Mələklər (bu yulardan) tutub Cəhənnəmi çəkib gətirəcəklər» . Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Qiyamət günü Günəş və Ay bir-birinin içinə salınıb Cəhənnəmə atılacaqlar» .

***Cəhənnəmin Dərinliyi:*** Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* – in yanında oturmuşduq. Bir gurultu səsi eşitdik. Rəsulullah - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bilirsinizmi bu nə idi?». Biz: «Allah və Rəsulu daha gözəl bilir» dedik. Peyğəmbər: «Bu Cəhənnəmə yetmiş il bundan əvvəl atılmış daşdır ki, indi onun dibinə çatıb (Başqa rəvayətdə: Cəhənnəmin kənarından aşağıya doğru yuvarlanan bir taş yetmiş il sonra Cəhənnəmin dibinə çatmaz )» . Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Həqiqətən insan fərqinə varmadan elə bir kəlimə işlədər ki, bununla yetmiş il Cəhənnəmə düşər» . Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Hüzun quyusundan Allaha sığının». Səhabələr: «Ey Allahın Rəsulu! Hüzun quyusu nədir?» deyə soruşdular. Peyğəmbər: «Cəhənnəmdə bir vadidir. Cəhənnəm o, vadidən hər gün yüz dəfə Allaha sığınır» deyə buyurdu. Səhabələr: «Ey Allahın Rəsulu! Ora kimlər girəcəkdir?» deyə soruşdular. Peyğəmbər: «Əməllərində riya edən kimsələr» deyə buyurdu . ***«O, günü yalanlamış olanlara Veyl vardır».*** *(əl-Mursəlat 15).* Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – buyurdu: «Veyl Cəhənnəmdə bir vadidir. Kafir orada qırx il batar. Lakin dibinə çatmaz» .

***Cəhənnəmin Hərarəti:*** Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Adəm övladlarının yandırdığı od Cəhənnəm odunun yetmiş də bir hissəsidir (Başqa rəvayətdə: **69** dəfə şiddətli-dir[1407])»[1408]. Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cəhənnəm odunu ağ olana kimi min il qalayıblar, sonra yenə də min il qırmızı olana qədər qalayıblar, sonra yenə də qap-qara olana kimi min il də qalayıblar. O, zülmət gecə qaranlığı olana kimi min il də yandı»[1409]. Ubey b. Kəb – *radıyallahu anhu* – deyir ki: ***"Yaxud onların əməlləri əngin dənizdəki qaranlığa bənzəyir".*** ***(ən-Nur 40).*** O, beş növ qaranlıqdır. Kəlamı qaranlıqdır, əməli qaranlıqdır, girişi qaranlıqdır, çıxışı qaranlıqdır, düşəcəkləri yer də atəşin qaranlığıdır". Dəhhaq – *rahmətullahi aleyhi* - deyir ki: "Cəhənnəm qaradır, suyu qaradır, ağacları və əhli də qaradır. ***"O gün neçə-neçə üzlər ağaracaq, neçə-neçə üzlər də qaralacaqdır".*** *(Ali İmran 106).* ***"Pis işlər görənlərə isə pisliyin cəzası onun misli qədər verilər. Onları zillət bürüyər. Onları Allahdan qoruya bilən***

---

[1400] Müslim 2184, 2842.
[1401] Buxari.
[1402] Müslim «Zuhd» 3/14.
[1403] Səhihul Cəmi 6870.
[1404] Əhməd.
[1405] Tirmizi 2384, İbn Məcə «Muqəddimə» 23.
[1406] Tirmizi 3164.
[1407] Muvatta «Cəhənnəm» 1.
[1408] Buxari, Müslim 5077.
[1409] Tirmizi, İbn Məcə.

***bir kimsə də yoxdur. Onların üzləri sanki zülmət gecənin parçalarına bürünmüşdür. Onlar Od sakinləridir və orada əbədi qalacaqlar".*** *(Yunus 27).*

***Cəhənnəmin Yeddi Qapısı: «Şübhəsiz ki, Cəhənnəm onların hamısına vəd olunmuş yerdir.*** *(Cəhənnəmin)* ***yeddi qapısı var. Hər qapıdan müəyyən bir dəstə girər».*** *(əl-Hicr 43,44).* Rəsulullah - *səllallahu aleyhi və səlləm* - buyurdu: «Cəhənnəmin yeddi qapısı vardır. Onlardan biri mənim ümmətimə qılınc qaldıranlar üçündür». Qapıların adları: 1. Cəhənnəm 2. Laza (od), 3. Hutəmə (odlanmış), 4. Səhr (Cəhənnəm), 5. Səqər (alov), 6. Cahim, 7. Həviyə (uçurum). Ubey b. Kəbb – *radıyallahu anhu* – deyir ki: «Cəhənnəmin yeddi qapısı vardır. Bunlardan biri Harurilər üçündür» .

***Cəhənnəmin Suyu: «Cəhənnəm odu onların üzlərini yandırar. Onlar orada dişləri ağarmış vəziyyətdə durarlar».*** *(əl-Muminun 104).* ***«Onların dəriləri yanıb bişdikcə əzabı*** *(həmişə)* ***dadsınlar deyə o, dəriləri başqası ilə əvəz edəcəyik».*** *(ən-Nisa 56).* ***«Onlar orada nə bir sərinlik, nə də içməyə bir şey tapacaqlar. Qaynar sudan və irindən başqa».*** *(ən-Nəbə 24-25).* ***«Hələ qarşıda Cəhənnəm vardır. İrinli-qanlı sudan içirdiləcəkdir. O, irinli-qanlı suyu qurtum-qurtum içər, onu zorla udar. Ona hər tərəfdən ölüm gələr lakin ölməz».*** *(İbrahim 16-17).* ***«Onlar imdad istədikdə onlara qətran*** *(yaxud yaradan axan irin qan)* ***kimi üzlərini büryan edən bir su ilə kömək ediləcəkdir. O, nə pis içki, o*** *(Cəhənnəm)* ***necə də pis məskəndir!».*** *(əl-Kəhf 29).* ***"O*** *(atəş)* ***onları uzaqdan görüncə*** *(kafirlər)* ***onun qəzəblə qaynamasını və uğultusunu eşidərlər".*** *(əl-Furqan 12).* ***"Onlar*** *(özləri kimi kafirlərlə)* ***qaynayan Cəhənnəmə atıldıqları zaman onun dəhşətli uğultusunu eşidəcəklər! O,*** *(kafirlərə olan)* ***qeyzindən az qala parça-parça olsun".*** *(Mulk 7-8).* ***"Rəbbi barəsində mübahisə aparan bu iki zümrə*** *(möminlər və kafirlər bir-birinə)* ***düşməndir. Onu inkar edənlər üçün atəşdən paltar biçilmişdır; başlarına da qaynar su töküləcəkdir. O su ilə qarınlarında olanlar*** *(bağırsaqları, ciyərləri)* ***və dəriləri əridiləcəkdir. Hələ onlar üçün*** *(başlarına vurulacaq)* ***dəmir toppuzlar da vardır".*** *(əl-Həcc 19-21).* Rəsulullah - *sallallahu aleyhi və səlləm* – ***Sədid*** - suyu haqqında buyurdu: «O, ağıza yaxınlaşdırılacaq və onu (Cəhənnəmdə əzab çəkən) heyvanın su içdiyi kimi içər. Su onun sifətinə yaxınlaşanda onu yandıracaq və içənin başının dərisi qopacaq. O, suyu içəndə isə onun bağırsaqları parça-parça olub arxa dəlikdən çıxacaqdır»[1411]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Cəhənəmliklərin başlarına qaynar su tökülür. Bu su vücudlarına nüfuz edəcəkdir. Belə ki, qarınlarına qədər çatır, içlərində nə var, nə yox hamısını atar (çölə) və ayaqlarını deşib keçər. ***"O su ilə qarınlarında olanlar*** *(bağırsaqları, ciyərləri)* ***və dəriləri əridiləcəkdir".*** *(əl-Həcc 20).* sonra əriyən bədənləri əvvəlki halını alar"[1412]. İbn Məsud – *radıyallahu anhu* – deyir ki, kim Sədidi görmək istəyirsə buna baxsın – deyərək insanları məscidə yönəldir. Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – deyir ki, bu su yağın çöküntüsünə oxşayır və onu üzə yaxınlaşdırdıqda başın dərisi onun üstünə düşər». *"(Allah əzab mələklərinə buyurar:)* ***"Onu tutub Cəhənnəmin tən ortasına sürüyün! Sonra başına əzab olaraq qaynar su tökün!*** *(Və ona belə deyin:) "(Bu əzabı)* ***bir dad görək! Sən ki*** *(öz aləmində)* ***çox qüvvətli, möhtərəm bir şəxs idin!".*** *(əd-Duhan 47-50).* Sələf alimləri bu ayənin Əbu Cəhl haqqında nazil olduğunu

---

[1410] Əhməd 2/94.
[1411] Əhməd.
[1412] Tirmizi "Cəhənnəm" 4, 2585.

söyləyirlər. Əvzai – *rahmətullahi aleyhi* - deyir ki: "Əbu Cəhl Qiyamət günü gətirilir və başının ortasından bir yarığ açılır. Sonra bir qab su gətirilir və bu yarığa tökülür və ona: "Dad, sən özünü çox şərəfli və böyük görürdün". ***Həmim* –** İbn Abbas – *radıyallahu anhu* – deyir ki: "Yandırıb yaxan sudur". Dahhaq – *rahmətullahi aleyhi* - deyir ki: "***Həmim* –** Allah yer və göyləri yaratdığı gündən bəri, Cəhənnəm əhli o sudan içənə qədər qaynayar və bu su onların başlarına tökülər". İbni Zeyd – *rahmətullahi aleyhi* - deyir ki: "***Həmim* –** Cəhənnəm əhlinin atəş hovuzlarında toplanan göz yaşlarıdır və bu su onlara içirdilir". ***Ğasaq* –** İbn Abbas – *radıyallahu anhu* – deyir ki: "Kafirin dərisi ilə əti arasından axan şeydir". Atiyyə – *rahmətullahi aleyhi* - deyir ki: "Cəhənnəm əhlinin dərisindən axan su". Əbu Səid – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Əgər Ğasaqdan bir qab bu dünyaya tökülsəydi onun pis qoxusunu dünya əhli hiss edərdi"[1413]. Mucahid – *rahmətullahi aleyhi* - deyir ki: "***Ğasaq* –** həddən çox soyuq olduğu üçün dadına baxılmayan sudur". Cabir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Uca və Böyük olan Allah içki içən şəxsə ***Tinətul Xabəldən*** içirəcəyinə söz vermişdir». Səhabələr: «Ey Allahın Rəsulu! ***Tinətul Xabəl*** nədir?» deyə soruşdular. Peyğəmbər: «Cəhənnəm sakinlərinin təri və ya (yanmaları nəticəsində) bədənlərindən axan sudur» . ***Muhl* –** Əli, İbn Abbas - *radıyallahu anhum* – deyirlər ki: "***Muhl* –** Yağın çöküntüsü kimi qaradır".

***Cəhənnəmliklərin Yeməyi Və İçməyi*: *«İrindən başqa yeməyi də yoxdur. Onu ancaq günahkarlar yeyər».*** *(əl-Haqqa 36,37).* ***«Onların yeməyi*** *(zəhərdən və acı)* ***zəridən başqa bir şey olmayacaqdır.*** *(O, yemək onlara)* ***nə qüvvət verər, nə də aclıqdan qurtarar».*** *(əl-Ğaşiyə 6-7).* *«(Ey insanlar!)* ***Qonaq olmağa bu Cənnət yaxşıdır, yoxsa zəqqum ağacı? Biz onu zalimlər üçün bir bəla etdik. O, elə bir ağacdır ki, Cəhənnəmin lap dibindən çıxar. Onun meyvəsi şeytanların başı kimidir. Onlar ondan yeyəcək və qarınlarını onunla dolduracaqlar. Sonra onlar üçün*** *(içməyə)* ***qaynar su ilə qatışmış irin vardır. Daha sonra onların qayıdacaqları yer mütləq yenə Cəhənnəmdir!».*** *(əs-Saffət 62-68).* ***«Həqiqətən*** *(Cəhənnəm-dəki)* ***zəqqum ağacı künahkar kimsənin yeməyidir».*** *(əd-Duhan 43-44).* ***"Sonra, siz ey*** *(haqq)* ***yoldan azanlar,*** *(haqqı)* ***dananlar! Şübhəsiz ki, zəqqum ağacından*** *(onun meyvəsindən)* ***yeyəcəksiniz, Qarınlarınızı onunla dolduracaqsınız. Üstündən də*** *(sizə bərk yanğı gəldiyi üçün)* ***qaynar su içəcəksiniz. Özü də onu susuzluq xəstəliyinə tutulmuş*** *(dəvə)* ***kimi içəcəksiniz. Bu onların haqq-hesab günündəki ziyafətidir.*** *(Ey kafirlər!)* ***Biz sizi*** *(yoxdan)* ***yaratdıq. Məgər (qiyamət günü yenidən dirildiləcəyinizi) təsdiq etməzmisiniz?".*** *(əl-Vaqiə 51-57).* Ənəs b. Məlik – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Əgər Zəqqumdan bir damcı bu dünyaya düşsəydi o, damcı dünyadakı canlıların yaşayışını təmin edən hər bir şeyi məhv edərdi. Artıq zəqqumdan başqa yeyəcəyi olmayan Cəhənnəm əhlinin halı necədir»[1415]. İbn Abbas – *radıyallahu anhu* – deyir ki: "Zəqqum ağacının əslinin atəşdən olduğunu bildirdi". Həsən – *radıyallahu anhu* – deyir ki: "Kökü Cəhənnəmin dərinliklərindən və budaqları üst tərəfinə qədər uzanır". Başqa rəvayətdə: "O, qaynayan bir ağacdır". Cəfər, Əbu Umran əl-Cuvəni – *rahmətullahi aleyhi* - rəvayət edir ki: "Bizə çatan xəbərlərə görə ondan alınan hər bir loxmanın qarşılığında o, da

---

[1413] Əhməd, Tirmizi, Həkim.
[1414] Müslim 3/1587.
[1415] Tirmizi 2584, Səhihul Cəmi 5126.

eynisini onu alandan alır". ***"Daha sonra onların qayıdacaqları yer mütləq yenə Cəhənnəmdir!».*** *(əs-Saffət 62-68).* Zəqqum yedikdən və qaynar su içdikdən sonra onları Cəhənnəmə geri götürürlər. Ayə qaynar suyun Cəhənnəmdən kənarda olduğuna dəlalət edir. Onlar Dəvənin suya götürülməsi kimi götürülürlər. Sonra isə Cəhənnəmə qaytarılırlar. ***"****(Onlara belə deyiləcəkdir:)* ***"Bu, günahkarların yalan hesab etdikləri Cəhənnəmdir!" Onlar onunla*** *(Cəhənnəm odu ilə)* ***qaynar su arasında dolanıb duracaqlar".*** *(ər-Rahmən 43-44).* Qatadə, İbni Cureyc – *rahmətullahi aleyhi* - və s. Rəvayət etmişlər. ***«Dərgahımızda qandallar və Cəhənnəm. Boğaza tıxılıb qalan yemək*** *(zəqqum)* ***və şiddətli əzab vardır!».*** *(əl-Muzəmmil 12-13).* İbn Abbas – *radıyallahu anhu* – deyir ki: "O, insanın boğazına ilişən bir tikandır (Tikanlı bitki). Nə aşağı gedər, nə də geri çıxar". ***"Bu gün bax burda onun yaxın bir dostu yoxdur. İrindən başqa bir yeməyi də yoxdur".*** *(əl-Həqqa 35-37).* İbn Abbas – *radıyallahu anhu* – deyir ki: "O, onların ətlərindən axan qan və sudur. (Atəş əhlinin yarasından axan sarı su) Bu da onların yeməyidir".

***Cəhənnəmliklərin Geyimi*: «***(Məgər Cənnətdə olanlar)* ***Cəhənnəm odunda əbədi qalıb bağırsaqları parça-parça edən qaynar su içirdiləcək kəslər kimi ola bilərlərmi?».*** *(Muhəmməd 15).* ***«Onu inkar edənlər üçün atəşdən paltar biçilmişdir. Başlarına da qaynar su töküləcəkdir».*** *(əl-Həcc 19).* ***«O, gün günahkarları qandallanmış görəcəksən! Köynəkləri qətrandan olacaqdır, üz gözlərini də atəş bürüyəcəkdir!».*** *(İbrahim 49-50).* Əbu Hureyrə - *radıyallahu anhu –* rəvayət edir ki, Rəsulullah *– sallallahu aleyhi və salləm –* buyurdu: «Geyimin topuqlardan aşağı keçən hissəsi Cəhənnəmdədir» . Əli, İbn Abbas - *radıyallahu anhum –* deyirlər ki: "***Qatran*** - ərinmiş qurğuşundur". İkrimə – *rahmətullahi aleyhi* - deyir ki: "Ərinmiş qızıldır". Mamər, Qatadə – *rahmətullahi aleyhi* - deyirlər ki: "Qurğuşundur". Əbu Məlik əl-Əşari - *radıyallahu anhu –* rəvayət edir ki, Peyğəmbər *– sallallahu aleyhi və salləm –* buyurdu: «Ümmətimdə cahiliyyə adətlərindən qalma dörd əlamət vardır ki, onu heç vaxt tərk etməyəcəklər. Əsl-nəcabətlə fəxr etmək, nəsəbə söymək, ulduzlardan vəsilə istəyərək yağmur diləmək və ölünün arxasıyca fəryad edərək ağlamaq. Ölünün arxasıyca fəryad edərək ağlayan kimsə ölümündə öncə tövbə etməzsə Qiyamət günü bədəni xəstəlik (qotur və ya dəridə xırda-xırda irin) olacaqdır və onun üzərinə qatrandan geyim geyindiriləcəkdir» .

***Cəhənnəmliklərin Yaşı*:** Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və salləm* – buyurdu: «Bir kimsə Cənnətlik olaraq ölərsə istər böyük, istər kiçik olsun, yaşı nə olursa olsun otuz yaşında bir kimsə olaraq Cənnətə girər və artıq bu yaş əbədiyyən dəyişməz. Cəhənnəmliklər üçün də vəziyyət belədir (Başqa rəvayətdə: otuz üç yaşında)»[1418]. Peyğəmbər - *sallallahu aleyhi və salləm* – buyurdu: "İstər qəzadan, istərsə də yaşın keçməsindən ötrü ölən hər kəs **33** yaşında dirildilir. Cənnət əhlidirsə: Adəm - *əleyhissəllam* – boyu, Yusuf - *əleyhissəllam* – ın surətində (gözəlliyi), Əyyub - *əleyhissəllam* – ın qəlbi üzərində yaradılır. Əgər Cəhənnəm əhli olarsa onu dağlar kimi böyüdər və şişirdərlər (Başqa rəvayətdə: İsa - *əleyhissəllam* – ın yaşı olaraq **33**[1419])"[1420].

---

[1416] Buxari 5887.
[1417] Müslim 934.
[1418] Tirmizi 2565.
[1419] İbn Əbi Dunyə rəvayət etmiş bax: "Nihayə" 2/201.
[1420] Təbərani.

***Cəhənnəmdə Kafirin Halı***: Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Qiyamət günü kafirin dişi Uhud dağı boyda, dərisinin qalınlığı da üç günlük yol qədərdir»[1421]. İbn Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kafir bir-iki fərsax uzunluğunda olan dilini Qiyamət günü yerdə sürür. İnsanlar onun üzərinə basarlar»[1422]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cəhənnəmdə kafirin iki çiyni arasındakı məsafə sürətli süvarinin yürüşü ilə üç günlük məsafədir»[1423]. Başqa rəvayətdə: "Oturduğu yer Məkkə ilə Mədinə qədər məsafədədir". Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cəhənnəm əhli dağlar kimi böyüdülmüş və şişirdilmişdir"[1424]. Zeyd b. Ərqam – *radıyallahu anhu* – deyir ki: "Cəhənnəm əhli atəş üçün o, qədər böyüdülür ki, bir dişi Uhud dağı qədər olur"[1425]. Həsən – *radıyallahu anhu* – Cəhənnəmdən bəhs edərkən dedi: "...Mələklər üzlərinə və arxalarına vuraraq onları Cəhənnəmə sürükləyərlər, onlardan biri onu döyən mələyə: Mənə mərhəmət et!" deyər. Mələk: "Sənə mərhəmətlilərin ən mərhəmətlisi mərhəmət etmədiyi halda mən sənə necə mərhəmət edim" deyər. Ammar – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: "Dünyada iki üzlü olanın Qiyamət günü atəşdən iki dili olur"[1426]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü İbrahim - *əleyhissəlam* - atası Azəri üzü qap-qara və toz içində olduğu halda görür». Atasına: «Mən sənə dünyada ikən mənə asi olma demədimmi?» Atası: «Bu gün artıq mən sənə asi olmayacağam» deyər. İbrahim: «Ya Rəbbim! Sən yenidən dirilmə günündə məni rüsvay etməyəcəyini vəd vermişdin. Rəhmətdən uzaq atamın halından daha rüsvay edici başqa nə var?» deyə buyurar. Allah: «Mən Cənnəti kafirlərə haram etdim. Ey İbrahim! Ayaqlarının altında nə var» deyə buyurar. İbrahim - *əleyhissəlam* - yerə baxar və qana bulaşmış bir sırtlan görür. Dərhal ayaqlarından tutulub Cəhənnəmə atılır»[1427]. Nə üçün kafirlər bu görkəmi alacaqlar? Cavab: Cəhənnəmin böyüklüyünə, hərarətinin şiddətinə görə Allah kafirləri börüdəcəkdir ki, əzabı daha çox dadsınlar. Çünki adi insan ora atıldığı zaman əriyib yoxa çıxar. *Allah Qorusun.*

***Cəhənnəm Haradadır***: Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Dəniz Cəhənnəmin özüdür»[1428]. Abdullah b. Amr – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «…Doğrusu dənizin altında atəş, atəşin altında da dəniz vardır»[1429]. İbn Abbas, Abdullah b. Səlam, Qatadə – *radıyallahu anhum* – deyirlər ki: "Cənnət - yeddi qat göydədir, Cəhənnəm isə - yeddi qat dənizin altında (Başqa rəvayətdə: Yerin yeddinci qatında)"[1430]. Abdullah b. Amr – *radıyallahu anhu* – deyir ki: "Kafirlərin ruhları yerin dibində yedinci təbəqədədirlər". İmam Əhməd, Yala b. Umeyyə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: "Dəniz Cəhənnəmdir". Yala bu mövzu haqqında

---

[1421] Müslim 2861, 5088, Tirmizi 2707.
[1422] Tirmizi 2583.
[1423] Müslim 2853, 5091.
[1424] Təbərani.
[1425] İmam Əhməd.
[1426] Əbu Davud.
[1427] Buxari «Ənbiya» 8.
[1428] Əhməd 4/223.
[1429] Əbu Davud «Cihad» 3/9.
[1430] Əbu Nuaym, İbni Xyzeymə, İbn Əbi Dunyə.

soruşulanda: ***“...Biz zalımlar üçün elə bir atəş hazırlamışıq ki, onun pərdələri** (dumanları) **onları bürüyəcəkdir...”.*** *(əl-Kəhf 29).* İbn Abbas – *radıyallahu anhu* – rəvayət edir ki: ***“Dənizlər od tutub yanacağı** (və ya dolub daşacağı) **zaman”.*** *(ət-Təkvir 6)* ayəsi barədə: Günəş, Ay və Ulduzlar dənizə salınır. Sonra bir külək gələr onu alov olana qədər üflər”[1431]. İbn Cərir, Səid b. Museyyibdən, o da Əli – *radıyallahu anhu* – dan rəvayət edir ki: Yəhudilərdən bir nəfərdən: “Cəhənnəm haradadır” deyə soruşuldu. O: “Dənizdir (Başqa rəvayətdə: Dənizin altında)” deyə cavab verdi. Əli: “O, doğru dedi” sonra: ***“Dənizlər od tutub yanacağı** (və ya dolub daşacağı) **zaman”.*** *(ət-Təkvir 6).* ***“Və dolub daşan** (alovlanan) **dənizə ki”.*** *(ət-Tur 6)* ayəsini oxudu. Səid b. Əbi əl-Həsən əl-Basri – *rahmətullahi aleyhi* - nin qardaşı deyir ki: “Dəniz Cəhənnəmin təbəqələrindən bir təbəqədir”.

Bəzi alimlər Cəhənnəmin də göydə olduğunu qeyd edirlər: Mucahid: ***“Göydə də ruzinin** (yağış, qar) **və vəd olunduğunuz şey** (mükafat, cəza) **vardır!** (Sizə vəd olunan mükafat, yaxud cəza Allah dərgahındakı lövhi-məhfuzda yazılmışdır)**”.*** *(əz-Zariyyat 22)* ayəsinin təfsirində: “Burada qəsd edilən Cənnət və Cəhənnəmdir” dedi. İmam Əhməd, Peyğəmbər - *sallallahu aleyhi və salləm* - buyurdu: “İsra gecəsi Cənnət və Cəhənnəmi səmada gördüm bu ayəni oxudu: ***“Göydə də ruzinin** (yağış, qar) **və vəd olunduğunuz şey** (mükafat, cəza) **vardır!** (Sizə vəd olunan mükafat, yaxud cəza Allah dərgahındakı lövhi-məhfuzda yazılmışdır)”. (əz-Zariyyat 22)*[1432]. Dorusunu Allah bilir!

***Cəhənnəmin Toppuzları**: “Hələ onlar üçün** (başlarına vurulacaq) **dəmir toppuzlar da vardır.** (Kafirlər) **oradan –** (Cəhənnəmdə düşdükləri) **qəmdən qurtarmaq istədikcə, yenidən ora qaytarılar və** (onlara): **“Dadın atəşin əzabını!”** (deyilər)**.** (əl-Həcc 21-22).* Əbu Səid – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və salləm* - buyurdu: «Cəhənnəmliklərə (əzab üçün) təhsis edilən dəmir toppuzlardan biri yerə qoyulacaq olarsa (dünyaya düşsə) bütün cinlər və insanlar toplansalar belə onu yerdən qaldıra bilməzlər»[1433]. Əbu Səid – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və salləm* - buyurdu: «Cəhənnəmdəki dəmir toppuzlardan biri ilə bir dağa vursalar o, dağı parçalıyar və toz halına salar»[1434].

***Cəhənnəmin Vəsfi:*** Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və salləm* – buyurdu: «Allah Cənnəti yaratdığı zaman Cəbrailə buyurdu: “Get ora bir bax!” O, da gedib Cənətə baxdı və: «(Ey Rəbbim!) Sənin izzətinə and olsun ki, onu eşidib və ora girməyən qalmayacaqdır. Hər kəs ora girəcəkdir» dedi. Allah Cənnətin ətrafını məkruhlarla (nəfsin xoşlanmadığı şeylərlə) bəzədi və: «İndi get ora bax!» deyə buyurdu. Cəbrail gedib ora bir də baxdı və: «Qorxuram ki, ora heç kimsə girməsin» dedi. Allah Cəhənnəmi yaradıb Cəbrailə: «Get ora bir bax!» deyə buyurdu. Cəbrail: «İzzətinə and olsun ki, onu eşidən ora girməyəcəkdir» dedi. Sonra Allah Cəhənnəmin ətrafını şəhvətlərlə (nəfsin xoşladığı şeylərlə) bəzədi və: «Get ona bir kərə də bax!» deyə buyurdu. Cəbrail də baxıb gəldikdən sonra: «İzzətinə and olsun ki, bir nəfər də belə qalmayıb hamının ora girməsindən qorxuram» dedi . Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və salləm* - buyurdu: «Cənnət zorluqlarla, Cəhənnəm isə şəhvətlərlə

---

[1431] İbn Əbi Dunyə, İbn Əbi Hətim.
[1432] İmam Əhməd, Hilal “Kitabu Sunnə”.
[1433] Əhməd 3/29.
[1434] Əhməd 3/29.
[1435] Əbu Davud 4744, Tirmizi 2563.

bəzədilmişdir». Əbu Musa – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü olduğunda hər müsəlmana bir Yəhudi və Xristian verilər və ona: «Bu sənin atəşdən qurtuluşun üçün sənə bir fidyə olaraq verilmişdir» deyilər. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günündə müsəlmanlardan bəzi kimsələr dağlar misalı günahlarla gəlirlər lakin Allah onların bu günahlarından bağışlayıb Yəhudilərə, Xristianlara yükləyər». Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in yanından bir cənazə keçdi. İnsanlar cənazə haqqında xeyirli sözlər dedilər. Peyğəmbər: «Vacib oldu!» deyə buyurdu. Sonra bir cənazə də keçdi. İnsanlar onun haqqında pis sözlər danışdılar. Peyğəmbər: «Vacib oldu!» deyə buyurdu. Ömər – *radıyallahu anhu* – : «Ey Allahın Rəsulu! Vacib olan nədir?» deyə soruşdu. Peyğəmbər: «Birinci cənazəni xeyirlə yad etdiniz və ona Cənnət vacib oldu. İkinci cənazəni isə pisliklə yad etdiniz və ona Cəhənnəm vacib oldu. Sizlər Allahın yer üzündəki şahidlərisiniz» deyə buyurdu. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Kafir ilə onu öldürən əbədiyyən Cəhənnəmdə bir yerdə olmaz, Allah yolunda ölən ilə Cəhənnəm atəşi bir yerdə olmaz, qulun qəlbində imanla həsəd bir yerdə olmaz». Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizə Cəhənnəm əhlindən xəbər verimmi?». Səhabələr: «Bəli, ey Allahın Rəsulu» dedilər. Peyğəmbər: «Bunlar simic, paxıl, təkəbbürlü kimsələrdir» deyə buyurdu. Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Bir nəfəri gətirib oda atacaqlar. Cəhənnəmdə bağırsaqları qarnından bayıra çıxacaqdır və orada eşşək dəyirmanın ətrafında fırlandığı kimi fırlanacaqdır. Cəhənnəm əhli onun ətrafında toplaşıb soruşacaqlar: «Ey filankəs, sənə nə olub? Məgər sən bizi günahlardan çəkinməyə və xeyirli işlər görməyə çağıran deyildin?». O: «Bəli, mən xeyirxaxlığa çağırırdım, lakin özüm buna əməl etmirdim, günahlardan çəkindirirdim, lakin özüm pis işlər edirdim». İbn Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Bir qadın evdə həps etdiyi pişiyə görə Cəhənnəmə düşdü. Pişiyi evdə həps edərək nə yemək vermiş, nə də onun özü üçün ov etməsinə izn vermişdir (Başqa rəvayətdə: Fahişə bir qadın isti bir gündə quyunun ətrafında fırlanan və susuzluqdan dilini çıxarmış bir köpək gördü. Qadın ayaqqabısını çıxarıb (quyudan su götürərək) köpəkə verdi. Bu səbəblə qadın bağışlandı». Bureydə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Hakimlər üç cürdür. Biri Cənnətlik, ikisi isə Cəhənnəmlikdir. Haqqı bilib doğru hökm verən Cənnətlikdir, haqqı bilib (bilə-bilə) ədalətsiz hökm verən Cəhənnəmlikdir, cahilcəsinə hökm verən də Cəhənnəmlikdir».

## CƏNNƏTİN VƏSFİ

***Cənnət Nemətləri*: «Etdikləri əməllərin mükafatı olaraq** *(Allah dərgahında)* **möminlər üçün göz oxşayan** *(onları sevindirəcək)* **nə cür nemətlər gizlənib**

[1436] Tirmizi «Cənnət» 4/21, Əhməd 3/254.
[1437] Müslim 2767.
[1438] Müslim «Tövbə» 3/50.
[1439] Buxari «Cənaiz» 86, Müslim 949.
[1440] Müslim 1891, Əbu Davud 2495.
[1441] Buxari, Müslim 2853.
[1442] Müslim, Səhihul Cəmi 7878.
[1443] Müslim 2242,2245.
[1444] Əbu Davud 3573.

***saxlandığını heç kəs bilməz».*** *(əs-Səcdə 17).* Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Sizdən birinizin Cənnətdəki bir parça yeri üzərinə Günəşin doğduğu və batdığı şeylərin hamısından xeyirlidir (Başqa rəvayətdə: Cənnətdəki bir qamçı miqdarında yer dünya və dünya nemətlərindən xeyirlidir)»[1445]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Əziz və Cəlil olan Allah: Mən yaxşı qullarım üçün heç bir gözün görmədiyi, heç bir qulağın eşitmədiyi və heç bir insanın qəlbindən keçirmədiyi şeylər hazırladım" buyurdu. Allah Kitabında bunu təsdiqləyən dəlil bu ayədir: "Etdiklərinin əvəzi olaraq onlar üçün nə kimi şeylər saxlandığını heç kimsə bilməz"[1446]. Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: "Allah Cənnət əhlinə: Ey Cənnət əhli! Deyə xitab edər. Onlar: "Ey Rəbbimiz! Sənin iki dəfə çağrışını qəbul etdik – buyur. Xeyir sənin iki əlindədir" deyərlər. Allah: "Razı oldunuzmu" deyə buyurar. Onlar: "Ya Rəbbi! Necə razı olmayaq. Sən bizə məxluqatdan heç kimə vermədiyin ehsanı verdin" deyərlər. Allah: "Bundan da daha qiymətlisini verimmi?" deyə buyurar. Onlar: "Ya Rəbbi! Bundan daha qiymətli nə ola bilər?" deyərlər. Allah: "Mən sizə rızamı halal edirəm. Artıq bundan sonra əbədiyyən sizə qəzəb etmərəm" deyə buyurar[1447].

***Cənnətin Çayları:*** ***«****(Ya Peyğəmbər!)* ***İman gətirən və yaxşı işlər görən şəxslərə müjdə var. Onlar üçün*** *(ağacları)* ***altından çaylar axan Cənnətlər vardır».*** *(əl-Bəqərə 25).* ***«Onları*** *(ağaclar)* ***altından çaylar axan Ədn Cənnətləri gözləyir».*** *(əl-Kəhf 31).* ***«Möminlərə vəd edilən Cənnətin vəsfi belədir.*** *(Ağacları)* ***altından çaylar axar, yeməkləri də, kölgələri də daimidir…».*** *(ər-Rəd 35).* ***«Müttəqilərə vəd olunan Cənnətin vəsfi belədir. Orada dadı dəyişməyən, qoxumayan sudan çaylar, tamı dəyişməyən süddən çaylar, içənlər üçün ləzzət verən şərabdan çaylar və təmiz baldan çaylar vardır…».*** *(Muhəmməd 15).* Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Sayhan (Amudərya), Ceyhan (Sırdəryə), Fərat və Nil bunların hər biri Cənnətin çaylarıdır»[1448]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnətdə yüz dərəcə vardır. Allah oranı yolunda vuruşan mücahidlər üçün hazırlamışdır. Hər iki dərəcə arasında yerlə göy arası qədər məsafə vardır. Allahdan dilədikdə Firdovsu diləyin. O, Cənnətin orta yerində ən üst yerdədir. Onun üzərində Allahın ərşi vardır. Cənnətin çayları oradan qaynayır (Başqa rəvayətdə: Dörd çay ondan qaynayır[1449])»[1450]. Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: "Kövsər Cənnətdə Rəbbimin mənə vermiş olduğu bir çaydır"[1451]. Mucahid – *rahmətullahi aleyhi* – deyir ki: "biz sənə Kövsəri verdik. Kövsər – çox xeyir verdik"[1452]. Ənəs – *radıyallahu anhu* – deyir ki: "***Kövsər –*** Cənnətdə bir çaydır". Aişə – *radıyallahu anhə* – deyir ki: "Cənnətdə bir çaydır. Kim barmaqlarını qulağına tıxayarsa belə bu çayın səsini eşidər"[1453].

---

[1445] Buxari 6/13, 3250, Müslim 1883.
[1446] Buxari 13/465, Müslim 2824.
[1447] Müslim.
[1448] Müslim 2839.
[1449] Tirmizi 2531.
[1450] Buxari 13/404, Tirmizi "Cənnət" 2530, 2533, Əhməd 3/339.
[1451] Müslim 400.
[1452] İbn Kəsir "Nihayə" 2/406.
[1453] İbn Kəsir "Nihayə" 2/406.

***Cənnətin Bulaqları*****: “Məgər sizdən biriniz istərmi ki, içində xurma ağacları, üzümlüklər,** *(ağacları)* **altından arxlar axan və cürbəcür meyvələr olan bir bağçası olsun...”.** *(əl-Bəqərə 266).* ***“Orada** (o iki Cənnətdə)* **fəvvarə verib qaynayan iki bulaq vardır”.** *(ər-Rahmən 66).* ***«Allahdan qorxub pis əmələrdən çəkinənlər isə Cənnətdə və bulaqlar başında olacaqlar».*** *(əl-Hicr 45).* ***«O, Cənnətdə iki axar bulaq vardır».*** *(əl-Mursəlat 41).* ***«Şübhəsiz ki, yaxşı əməl və itaət sahibləri** (Cənnətdə)* ***kafur qatılmış** (soyuq və xoş ətirli)* ***şərab içəcəklər. O,** (kafur)* ***elə bir bulaqdır ki, Allahın bəndələri ondan içəcək və onu** (istədikləri yerə)* ***asanlıqla axıdacaqlar».** (İnsan 5,6).* ***«Orada onları zəncəfil qatılmış** (zəncəfil dadı verən)* ***şərab da içirdiləcəkdir.** (Zəncəfil)* ***Cənnətdə bir bulaqdır ki,** (suyu boğazdan)* ***çox rahat keçdiyi üçün Səlsəbil adlanır».** (İnsan 17,18).* ***“Ona təsnim (suyu) qatılmışdır. O** (təsnim)* ***elə bir çeşmədir ki, ondan** (təmiz halda)* ***yalnız** (Allaha)* ***yaxın olanlar içər** (qalanlara isə o rəhiq şərabına qatılıb verirlər)”. (Mutaffifin 27-28).* Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: “Cənnətdə su dənizi, bal dənizi, süd dənizi və içki dənizi var. Sonra bunlardan çaylar qaynayır”[1454].

***Cənnətin Ağacları Və Meyvələri*****: «Həqiqətən müttəqilərin nicat yeri** *(Cənnət),* **bağçaları və üzüm bağlarıdır».** *(ən-Nəbə 31,32).* ***«O, iki Cənnətdə növbənöv meyvələr, xurma və nar vardır».*** *(ər-Rəhman 68).* ***«Sağ tərəf sahibləri kimdir onlar? Onlar tikansız sidr ağacları, salxım-salxım sallanmış məuz** (banan)* ***ağacları altında, çəkilməyən daimi kölgəliklərdə, axar su kənarında, bol meyvələr, tükənməz və qadağan edilməyən meyvələr içində».*** *(əl-Vaqiə 27-33).* ***«(Müttəqilər) İstədikləri meyvələr içində olacaqlar».*** *(əl-Mursəlat 42).* ***«Onlar üçün** (ağacları)* ***altından çaylar axan Cənnətlər** (bağlar)* ***vardır. O, Cənnətlərin meyvələrindən bir ruzi yedikləri zaman: «Bu bizim əvvəlcə** (dünyada)* ***yediyimiz ruzidir» – deyəcəklər. Əslində isə bu meyvələr zahirən bənzəyir».*** *(əl-Bəqərə 25).* ***“Onlar orada** (taxtlara)* ***söykənib cürbəcür meyvələr və içkilər** (Cənnət içkiləri)* ***istəyəcəklər”.** (Sad 51).* ***“Onlar orada** (Cənnət nemətlərinin tükənməzliyinə)* ***arxayın olaraq hər meyvədən istəyəcəklər”.** (əd-Duhan 55).* ***“Orada sizin üçün bir çox meyvələr vardır, onlardan yeyəcəksiniz!”.** (əz-Zuhruf 73).* ***“(Cənnət ağaclarının)** kölgələri üstlərinə düşəcək, meyvələri də onların ixtiyarında olacaqdır* *(istədikləri yerdə, istədikləri zaman onları dərib yeyə biləcəklər)”. (İnsan 14).* İbn Abbas – *radıyallahu anhu* – deyir ki: “Meyvələrdən almaq istədiyi zaman meyvələr əyilir, o da istədiyini ayaqda ikən, oturarkən alır”[1455]. Səhl b. Sad – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnətdə bir ağac vardır ki, süvari onun kölgəsində yüz il at çapsa yenə də kölgəsi qurtarmaz (Başqa rəvayətdə: İstəsəniz bu ayəni oxuyun: ***“Çəkilməyən** (daimi)* ***kölgəliklərdə”.** (əl-Vaqiə 30[1456])»*[1457]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnətdə gövdəsi qızıldan olmayan heç bir ağac yoxdur»[1458]. ***Tuba*** – Cənnətdə ağacdır. Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «***Tuba*** – məni görüb iman gətirən kimsəyə. ***Tuba*** -Yenə də ***Tuba*** o, kimsəyə ki, məni görməyib lakin iman gətirmişdir»[1459]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir

---

[1454] Tirmizi 2571.
[1455] İbni Mubarək “Zuhd” 230, Təbəri “Təfsir” 29/39, İbn Əbi Şeybə “Musənnəf” 13/141.
[1456] Buxari 11/319, Tirmizi 3292.
[1457] Müslim 2826, 5055.
[1458] Tirmizi 2645, 2525.
[1459] Əhməd 3/71, əl-Albani «Səhihul Cəmi» 3923.

ki, bir nəfər Rəsulullah - *sallallahu aleyhi və səlləm* – dən soruşdu: «***Tuba*** nədir?». Peyğəmbər: «O, Cənnətdə uzunluğu yüz il olan bir ağacdır» deyə buyurdu (Gövdəsinin böyüklüyü nə qədərdir? Sənin qəbilənin dəvələrindən güclü bir dəvə onun gövdəsinin ətrafında dolansa arxa ayaqlarının diz hissəsi sürtülənə qədər və o, heyvan qocalana qədər yol getsə yenə də gövdənin ətrafını dolanıb qurtara bilməz[1460])[1461]. Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: "Cənnətdə elə bir ağac vardır ki, süvari sürətli, təlimli və yaxşı cinsdən olan bir at ilə **100** il çapsada onu bitirməz"[1462]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: "Şübhəsiz ki, Cənnətdə bir ağac vardır ki, bir süvari onun kölgəsində **100** il çapar"[1463]. Əbu Hureyrə - *radıyallahu anhu* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Cənnətdə elə bir ağac yoxdur ki, gövdəsi qızıldan olmasın"[1464]. Əbu Musa – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: "Allah, Adəm - *əleyhissəlam* - ı Cənnətdən endirdi və ona hər şeyin sənətini öyrətdi, onu Cənnət meyvələri ilə bəslədi. Sizin meyvələriniz Cənnət meyvələrindəndir. Lakin bunlar xarab olur, onlar isə xarab olmaz"[1465].

***Cənnətin Çiçəkləri:*** Abdullah b. Amr – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnətin çiçəklərinin seyyidi (ən üstünü) xınadır»[1466]. Osman ən-Nəhdi – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Sizdən birinizə reyhan verildiyi təqdirdə onu rədd etməsin. Çünki o, Cənnətdən çıxmadır»[1467].

***Cənnət Heyvanları: «Və istədikləri hər cür quş əti ilə onların dövrəsində fırlanacaqlar».*** *(əl-Vaqiə 21).* Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, bir nəfər: «Ey Allahın Rəsulu! Kövsər nədir?». Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «O, Allahın mənə verdiyi Cənnətdə bir çaydır ki, süddən ağ və baldan daha dadlıdır. O, çayda boyunları dəvə boyunları kimi quşlar vardır». Ömər: «Şübhəsiz ki, bunlar bəslənmiş quşlardır» dedi. Peyğəmbər: «Onları yeyəcək olanlar onlardan da daha bəslənmişlərdir» deyə buyurdu[1468]. İbn Məsud – *radıyallahu anhu* – rəvayət edir ki, bir nəfər başı ip ilə bağlı dəvə ilə Rəsulullah - *sallallahu aleyhi və səlləm* – in yanına gələrək: «Ya Rəsulullah! Bu dəvə Allah yolundadır» dedi. Peyğəmbər: «Sənin üçün Cənnətdə yeddi yüz başı iplə bağlı dəvə vardır» deyə buyurdu[1469]. Bureydə – *radıyallahu anhu* – rəvayət edir ki, bir nəfər Rəsulullah - *sallallahu aleyhi və səlləm* – dən soruşdu: «Ya Rəsulullah! Cənnətdə at varmı?». Peyğəmbər: «Allah səni Cənnətə daxil edərsə orada səni qırmızı yaqutdan bir ata mindirilməni və o, atın Cənnətdə səninlə istədiyin yerə uçmasını istədiyin təqdirdə bu arzunu yerinə yetirər» deyə buyurdu. Bir başqa adam: «Ya Rəsulullah! Cənnətdə dəvə varmı! Deyə soruşdu. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – əvvəlki adama söylədiklərini buna

---

[1460] Əhməd 4/183, 3/71.
[1461] Buxari 6/233, 8/481, Müslim 2826.
[1462] Müslim 5056.
[1463] Müslim 5054.
[1464] Tirmizi "Cənnət" 1, 2527.
[1465] Təbərani, Nihayə 2/427.
[1466] əl-Albani «Səhih Silsilə» 3/407.
[1467] Tirmizi 2792.
[1468] Tirmizi 2665.
[1469] əl-Albani «Səhih Silsilə» 2/228.

söyləmədi. Lakin: «Əgər Allah səni Cənnətə daxil edərsə orada sənin nəfsinin istədiyi və gözünün xoşladığı hər şey olacaqdır»[1470].

***Cənnətdə Əkinçilik:*** Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* – yanında bir bədəvi olan zaman Cənnət əhlindən birinin əkinçiliklə məşğul olmaq üçün Rəbbindən izn istədiyindən söz etdi. Allah: «Hər istədiyindən faydalanacaq durumunda deyilsənmi?» deyə buyurdu. Adam: «Bəli, lakin əkinçiliklə məşğul olmaq istəyirəm» dedi. Allah ona izn verir. Həmən adam toxumunu atar-atmaz, göz açıb qırpıncaya qədər hər şey tamamlanar. Əkin bitmiş dağlar kimi dəstə-dəstə məhsul toplanıb, bir yerə yığılmışdır…»[1471].

***Cənnətin Otaqları Və Dərəcələri: «Lakin Rəbbindən qorxanları*** *(Cənnətdə)* ***bir-birinin üstündə tikilmiş otaqlar gözləyir. Onların altından çaylar axar. Bu Allahın vədidir. Allah vədə xilaf çıxmaz!».*** *(əz-Zumər 20).* ***"Zərər çəkmədən*** *(üzürsüz səbəbə görə evlərində)* ***əyləşən möminlərlə Allah yolunda öz malları və canları ilə cihad edən*** *(vuruşan)* ***kimsələr bir olmazlar. Allah malları və canları ilə vuruşanları*** *(evlərində)* ***əyləşənlərdən*** *(cihada getməyənlərdən)* ***dərəcə etibarilə üstün tutdu. Allah bunların hamısına*** *(hər ikisinə savab)* ***vəd etmişdir.*** *(Lakin)* ***Allah mücahidlərə*** *(evlərində)* ***oturanlardan daha böyük mükafatlarla imtiyaz vermişdir.*** *(Onları)* ***Allah tərəfindən yüksək dərəcələr, bağışlanma və mərhəmət gözləyir. Allah bağışlayandır, rəhm edəndir".*** *(ən-Nisa 95-9).* ***Onlar həqiqi möminlərdir. Onların öz Rəbbi yanında dərəcələri vardır. Onları*** *(Qiyamət günü)* ***bağışlanma və*** *(Cənnətdə)* ***tükənməz*** *(gözəl, minnətsiz)* ***ruzi gözləyir!".*** *(əl-Ənfal 4).* ***"Allahın rizasını qazanmaq ardınca gedən şəxs, Allahın qəzəbinə düçar olmuş şəxs kimi ola bilərmi? Onun*** *(qəzəbə düçar olanın)* ***yeri Cəhənnəmdir. O yer necə də pisdir! Onların Allah yanında*** *(bir-birindən fərqli)* ***dərəcələri vardır. Allah onların etdiyi işləri görəndir".*** *(Ali İmran 162-163).* Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnətliklərdən bəziləri aralarında üstünlük səbəbi ilə yüksək otaqlarda oturanları, üfüqdə məşriqdən məğribə gedən parlaq ulduzları gördükləri kimi görəcəklər»[1472]. Səhl b. Sad – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Şübhəsiz ki, Cənnət əhli, Cənnətdə olan evi, sizin göydə ulduzu gördüyü kimi görəcəkdi"[1473]. Əli – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *səllallahu aleyhi və səlləm* - buyurdu: «Cənnətdə içi çölündən, çölü də içindən görünən otaqlar vardır. Allah bu otaqları yemək yedirən, oruc tutan və insanlar yatarkən namaz qılanlar üçün hazırlamışdır»[1474]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, bir dəstə səhabə: "Ya Rəsulullah! Cənnətdən danış, orada nə cür evlər var" dedilər. O: "Kərpiclərin biri qızıldan, biri gümüşdən, gili isə müşkdür. Çınqılı mirvari və yaqut, tozu zəfərandır. Ora düşən səadətə çatacaq və ümidsiz olmayacaqdır, əbədidir və ölməyəcək. Orada paltar köhnəlmir, gənclər isə ölmürlər"[1475]. Əbu Səid - *radıyallahu anhu* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Cənnətdə yüz dərəcə vardır. Bütün aləmlər bunlardan birinin içində toplansa hamısına bəs edər"[1476]. Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: "Quran sahibi

[1470] Tirmizi 2543, 2666, Əbu Nuaym "Sıfət əl-Cənnəh" 429.
[1471] Buxari 7519, 13/487, 5/27.
[1472] Buxari 6556, Müslim 2831.
[1473] Müslim 5058.
[1474] Tirmizi «Cənnət» 3/4, Əhməd 1/156.
[1475] Əhməd.
[1476] Tirmizi "Cənnət" 4, 2534.

Cənnətə daxil olduğu zaman ona: Oxu və yüksəl. O, kimsə oxuyar və hər bir ayədə bir dərəcə yüksəlir. Bildiyi son ayəni oxuyana qədər bu beləcə davam edər"[1477].

***Cənnət Çadırları Və Qadınları:* *«Çadırlarda gözlərini*** *(yalnız öz ərlərinə)* ***dikmiş hurilər vardır».*** *(ər-Rəhman 72).* ***«Özlərinin həmçinin əməli saleh ataları, zövcələri və övladlarının daxil olacaqları Ədn Cənnətləri gözləyir…».*** *(ər-Rəd 23).* ***«Onlar*** *(mömin kişilər)* ***və zövcələri kölgəliklərdə*** *(yumşaq)* ***taxtlara söykənmişlər».*** *(Yasin 56).* ***«Siz də zövcələriniz də sevinc içində Cənnətə daxil olun».*** *(əz-Zuxruf 70).* İbn Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnətdə içi incidən hazırlanmış bir çadır vardır ki, altımış mildir. Hər tərəfində biri digərini görməyən zövcələr vardır. Mömin onları dolaşıb ziyarət edər» . İbn Məsud – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnət əhlinin qadınlarından bir qadının baldırının bəyazlığı yetmiş qat Cənnət libaslarının altından görünər və hətta onun iliyi də görünər. Allah: «Çünki o, qadınlar sanki yaqut və mərcandırlar» deyə buyurur .

***Cənnət Huriləri: «Həmçinin onları iri gözlü hurilərlə evləndirəcəyik».*** *(əd-Duxan 54).* ***«Sinələri yenicə dolmuş həmyaşıd qızlar».*** *(ən-Nəbə 33).* ***«Şübhəsiz ki, biz Cənnət qadınlarını başqa cür yaradacağıq! Onları bakirə qızlar, ərlərini sevən, həmyaşıdlar edəcəyik».*** *(əl-Vaqiə 35-37).* ***«O, Cənnətdə gözlərini*** *(yalnız ərlərinə)* ***dikmiş, bundan əvvəl özlərinə heç bir insan və cin toxunmamış qadınlar vardır».*** *(ər-Rəhman 56).* ***«****(Onlar üçün orada)* ***iri gözlü, qəşənk hurilər də vardır. O, hurilər sanki sədəf içində gizlənmiş incidirlər».*** *(əl-Vaqiə 22.23).* Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnətlilərdən bir qadın dünya üzünə çıxsa bütün dünyanı işıq bürüyər, (gözəl) qoxu ilə doldurar. O, qadının baş örtüsü dünya və içindəkilərdən xeyirlidir» . Miqdad b. Maddan – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *allallahu aleyhi və səlləm* - buyurdu: «Allah qatında şəhid üçün altı xislət vardır. İlk qanı axarkən bağışlanır, Cənnətdə oturacağı yeri görür, qəbr əzabından qorunur, Cəhənnəm odundan əmin olar, başına əzəmətli bir tac qoyular ki, onun yaqutları dünya və içindəkilərdən xeyirlidir, yetmiş iki huri ilə evləndirilər, qohum-əqrabasından yetmiş nəfərə şəfaətçi olar» . Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnətdə möminə bu qədər və bu qədər cinsi münasibət qüvvəsi veriləcəkdir». Bir nəfər: «Ya Rəsulullah! Onun gücü çatacaqmı?» deyə soruşdu. Peyğəmbər: «Ona yüz kişinin gücü veriləcəkdir» deyə buyurdu . İbn Abbas – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Uhudda şəhid olan qardaşlarınız vara! Allah onların ruhlarını Cənnətdəki yaşıl quşların içinə qoydu. Onlar Cənnətin çaylarına gedən, Cənnət meyvələrindən yeyən və ərşin gölgəsində istirahət edən quşlardır. Şəhidlər beləcə yeyib, içib dincəldikdə deyərlər: «Qardaşlarımıza kim bu xəbəri çatdıra bilər ki, biz Cənnətdə diriyik və ruzi yeyirik? Bu xəbər onlara getməlidir ki, onlar Cənnətə qarşı istəksiz olmasınlar və cihadda qorxaq olmasınlar». Allah onlara cavabən: «Sizin xəbərinizi Mən çatdıracağam» deyə buyurdu və bu ayəni nazil etdi: ***«Allah yolunda öldürənləri heç də ölü zənn etmə! Xeyr, onlar öz rəbbinin***

---

[1477] Əhməd 3/40.
[1478] Buxari 3243, Müslim 2838.
[1479] Tirmizi 2654, Müslim 2834.
[1480] Buxari 2796.
[1481] Tirmizi 1712, İbn Məcə 2799.
[1482] Tirmizi 2659.

***yanında diri olub ruzi yeyərlər».*** *(Ali İmran 169)»* . Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnətə girən heç kimsə dünyaya geri dönmək istəməz, yer üzündə olan hər şey orada vardır. Lakin şəhid belə deyildir. O, Cənnətdə ona verilən nemətlərə görə yer üzünə dönüb on dəfə şəhid olmağı təmənni edər» .

***Cənnətdə Qadının Son Əri İlə Olması:*** Əbu Darda – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Qadının son əri (onunla birlikdə) Cənnətdədir». Ummu Dərdə: «Cənnətdə əbu Dərda ilə evlənməyənədək bir də ərə getmərəm» dedi .

***Cənnət Əhlinin Libası Və Zinətləri: «Və onları etdikləri səbr müqabilində Cənnətlə və*** *(geyəcəkləri)* ***ipəklə mükafatlandıracaq-dır».*** *(İnsan 12).* ***«Onlar orada qızıl və incilərlə bəzənəcəklər, orada libasları da ipəkdən olacaqdır».*** *(əl-Həcc 23).* ***«Onlar Ədn cənnətlərinə daxil olacaq, orada qızıl bilərziklər və incilərlə bəzənəcəklər. Libasları da ipəkdən olacaqdır».*** *(Fatir 33).* ***«****(Cənnət əhlinin)* ***əyinlərində taftadan və atlasdan yaşıl libaslar olacaq, onlara gümüşdən bilərziklər taxılacaqdır».*** *(İnsan 21).* ***"Taftadan və atlazdan (nazik və qalın ipdən) libaslar geyib qarşı-qarşıya əyləşəcəklər".*** *(əd-Duhan 53).* ***"...nazik və qalın ipəkdən*** *(taftadan və qumaşdan)* ***yaşıl paltarlar geyəcəklər. O, nə gözəl mükafat, o*** *(Cənnət)* ***necə də gözəl məkandır!".*** *(əl-Kəhf 31).* ***"****(Cənnət əhlinin)* ***əyinlərində taftadan və atlazdan*** *(nazik və qalın ipəkdən)* ***yaşıl libaslar olacaq, onlara gümüşdən bilərziklər taxılacaqdır. Rəbbi onlara çox pak bir şərab içirdəcəkdir".*** *(İnsan 21).* Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Hər kim Cənnətə girərsə naz və nemət içində xoş hal olar. Ona heç bir sıxıntı isabət etməz. Libasları köhnəlməz, gəncliyi də bitməz. Cənnətdə onun üçün heç bir gözün görmədiyi, heç bir qulağın eşitmədiyi və heç bir bəşərin qəlbinə gəlməyən şeylər vardır"[1486]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – qızıl üzük taxmağı qadağan etmişdir (Başqa rəvayətdə: Ümmətimdən hər kim qızıl taxdığı təqdirdə ölərsə Allah da onu Cənnətdəki qızıldan məhrum edər)»[1487]. Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Allaha və axirət gününə iman edən kimsə ipək və qızıl geyinməsin (Başqa rəvayətdə: Bu ikisi ümmətimin kişilərinə haram, qadınlarına isə halal edildi)»[1488]. bir nəfər Rəsulullah - *sallallahu aleyhi və səlləm* – dən soruşdu: «***Tuba*** nədir?». Peyğəmbər: «O, Cənnətdə uzunluğu yüz il olan bir ağacdır». Cənnət əhlinin libasları onun tumurcuqlarından çıxar" deyə buyurdu[1489]. Cənnət əhlinin **70**-ə yaxın libasları olur[1490].

***Cənnət Əhlinin Taxtları Və Yataqları: «Orada uca taxtlar,*** *(çeşmələr kənarına)* ***qoyulmuş piyalələr, bir yanına düzülmüş*** *(yumşaq)* ***balışlar və dövşənmiş nəfis xalılar vardır».*** *(əl-Ğaşıyə 13-16).* ***«Onlar orada astarları qalın ipəkdən olan döşəklərə söykənmiş olacaqlar».*** *(ər-Rəhman 54).* ***«Səf-səf düzülmüş taxtlara söykəndiyiniz halda».*** *(ət-Tur 20).* ***«Onlar qızıl-gümüş, ləl-cəvahiratla bəzənmiş taxtlar üstündə qərar tutacaq, o taxtlara söykənib bir-biri ilə qarışı-qarşıya əyləşəcəklər».*** *(əl-vaqiə 15,16).*

---

[1483] Əbu Davud 2520.
[1484] Buxari «Cihad» 5,21, Müslim 1877.
[1485] əl-Alabni «Səhihul Cəmi» 6/14.
[1486] Müslim 2836.
[1487] Buxari, Əhməd.
[1488] Həkim, Əbu Davud, Nəsəi.
[1489] Əhməd 3/71, Heysəmi "Məcmuaz Zəvaid" 10/67.
[1490] İbn Əbi Dunyə "Tərğib vət Tərhib" 4/530, İbni Mubarək "Zuhd" 74.

***Cənnət Əhlinin Xidmətçiləri***: ***«Onların dövrəsində həmişə cavan xidmətçi oğlanlar dolanacaqdır. Cənnət bulağından axan*** *(şərab)* ***dolu piyalələr. Kuzələr və qədəhlərlə.*** *(Dünyadakı şərabdan fərqli olaraq)* ***o, şərabdan başları ağrımaz və keflənməzlər.*** *(O, cavan xidmətçilər Cənnətdə olanların)* ***bəyənib seçdikləri meyvələr və istədikləri hər cür quş əti ilə onların dövrəsində fırlanacaqlar».*** *(əl-Vaqiə 17-21).* ***"Onların dövrəsində həmişəcavan*** *(xidmətçi)* ***oğlanlar olacaqdır. Onları gördükdə, sanki*** *(ətrafa)* ***səpilmiş inci olduqlarını zənn edərsən".*** *(İnsan 19).* İbn Abbas, Mucahid, Muqatil, əl-Kəlbi – *Allah onlardan razı olsun* - deyirlər ki: "Ölməyəcək uşaqlar (Yəni: Qocalmazlar və dəyişməzlər)" [1491] . Ayədə keçən ***Muhallid –*** qulaqlarında küpə və bilərzikli deməkdir[1492]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Bir nəfər Cənnətə girdiyi zaman Cənnət əhlinin surətinə bürünər, onların geyindiyini geyinər, taxdığını da taxar. Ona zövcələri, xidmətçiləri göstərilər. Onu sevinc sərxoşluğu bürüyər. Əgər ölmüş olsaydı bu sevinc sərxoşluğundan ölərdi. Ona: Bax, bu sevinc sərxoşluğu əbədi olaraq davam edəcəkdir"[1493]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Qul Cənnətə girər-girməz ona inci **70** min xidmətçi qarşılar"[1494]. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Cənnət əhlindən dərəcəsi ən aşağı olanın **80** min xidmətçisi, **72** zövcəsi vardır. Onun üçün incidən, xrizolitdən və yaqutdan bir çadır qurular. Bu çadır Cabiyədən Sanaya qədər uzanan bir böyüklükdədir"[1495]. Bu uşaqların kim olması barədə ixtilaf vardır: Əli, Həsənul Basri – *rahmətullahi aleyhi* - deyirlər ki: "Onlar nə günah, nə də savab qazanmadan ölmüş olan müsəlman uşaqlardır. Onlar Cənnət əhlinin xidmətçiləri olurlar. Çünki Cənnətdə uşaq yoxdur"[1496]. Bəziləri də qeyd edirlər ki: Bu uşaqlar müşriklərin uşaqlarıdır ki, Cənnət əhlinə xidmət edirlər. Lakin gətirdikləri dəlillər zəifdir. *Diğrusunu Allah bilir!*

***Cənnətin Bazarları:*** Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnətdə bir bazar vardır. Cənnətlilər hər cümə günü oraya gələrlər. Bir şimal küləyi əsər. Üzlərinə və libaslarına cürbəcür ətirli iylər yayar. Cənnətliklərin gözəllikləri artar. Artmış gözəlliləri ilə zövcələrinə dönərlər. Zövcələri onları gördükdə: «Vallahi bizdən sonra gözəlliyiniz nə qədər artmışdır?» deyərlər. Onlar da: «Vallahi sizin də bizdən sonra gözəlliliyiniz artmışdır!» deyərlər .

***Cənnət Əhlinin Yemək Və İçməyi: "Allahdan qorxub pis əməllərdən çəkinənlərə*** *(möminlərə)* ***vəd edilən Cənnətin vəsfi belədir:*** *(ağacları)* ***altından çaylar axar, yeməkləri də, kölgələri də daimidir. Bu, Allahdan qorxub pis əməllərdən çəkinənlərin aqibətidir. Kafirlərin aqibəti isə Cəhənnəmdir!".*** *(ər-Rəd 35).* ***"Onları istədikləri meyvə və ətlə*** *(bol-bol)* ***təmin edəcəyik. Onlar orada bir-birinə*** *(şərab dolu)* ***qədəh ötürəcəklər. Onda*** *(cənnət şərabının xislətində dünyakından fərqli olaraq)* ***nə lağlağılıq, nə də günaha təhrik vardır".*** *(ət-Tur 22-23).* Cabir – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnət əhli kimsələr yeyib içərlər, lakin böyük-kiçik ayaqyoluna çıxmazlar, burun suyu və

---

[1491] Qurtubi 17/202.
[1492] Qurtubi 17/203.
[1493] İbni Mubarək "Zuhd" 129, İbn Əbi şeybə "Musənnəf" 13/149, Əbu Nuaym "Hilyə" 2/252.
[1494] İbni Mubarək "Zuhd" 128.
[1495] Tirmizi "Cənnət" 23, 2565.
[1496] Qurtubi 17/203, Beyhəqi "əl-Bas vən Nuşur" 370.
[1497] Müslim 2833.

tüpürməzlər. Yeyəcəkləri bir misk kimi bir tərləmə və gəyirməklə çölə çıxar (Başqa rəvayətdə: Onların əxlaqı bir tək adamın əxlaqıdır. Onların surəti də Adəmin surətidir ki, onun boyu altımış dirsəkdir o, səmadadır[1498])»[1499].

***Cənnətliklərin İlk Yeyəcəkləri:*** Səvban – *radıyallahu anhu* – rəvayət edir ki, Yəhudi alimlərindən biri Rəsulullah - *sallallahu aleyhi və səlləm* – in yanına gələrək dedi: «Qiyamət günü yer və göy başqa yer və göylə əvəz olunacaqdır onda insanlar harada olacaqlar?» dedi. Peyğəmbər: «Sıratın üzərində» buyurdu. O: «Sıratdan ilk keçən kim olacaqdır?» dedi. Peyğəmbər: «Mühacirlərin fəqirləri» deyə buyurdu. O: «Cənnətə girənlərin ilk hədiyyələri nə olacaqdır» dedi. Peyğəmbər: «Balina balığının ciyərinin yanındakı ziyadəsi (artığı)» deyə buyurdu. Yəhudi: «Yeyəcəkləri nə olacaqdır?» dedi. Peyğəmbər: «Cənnətin ətrafında bəslənən Cənnət öküzü onlar üçün kəsiləcək» deyə buyurdu. Yəhudi: «İçkiləri nə olacaqdır?» dedi. Peyğəmbər: «İçəcəkləri Cənnətdə səlsəbil adlı bulaqdan olacaq» deyə buyurdu. O: «Səndən uşaq haqqında soruşuram» dedi. Peyğəmbər: «Kişinin mənisi bəyazdır, qadının isə sarıdır. İkisi birləşdikdə kişinin mənisi üstünlük təşkil edərsə Allahın izni ilə uşaq oğlan, yox əgər qadının mənisi üstünlük təşkil edərsə onda uşaq Allahın izni ilə qız doğular» deyə buyurdu. Yəhudi: «Vallahi doğru söylədin! Sən həqiqətən də haqq Peyğəmbərsən» dedi. Peyğəmbər: «Mən bu suallardan heç birini bilmirdim. Ta ki. Allah onları mənə bildirənə qədər»[1500]. İbn Abbas – *radıyallahu anhu* – rəvayət edir ki, Yəhudi alimlərindən biri Rəsulullah - *səllallahu aleyhi və səlləm* – in yanına gələrək dedi: «Ey Əbul Qasım! Yalnız Peyğəmbərlərə məlum olan xüsusiyyətlər haqqında soruşacaqlarımız barəsində bizə xəbər ver!». Peyğəmbər: «İstədiyiniz şey barəsində soruşun, lakin Yaqub – *əleyhissəlam* – övladlarından vəd aldığı kimi siz də Allah qarşısında vəd verin ki, əgər görsəniz dediklərim doğrudur mənə tabe olub İslam dinini qəbul edəcəksiniz!» deyə buyurdu. Onlar: «Qoy sən deyən olsun» dedilər. Peyğəmbər: «İstədiyinizi soruşun!» deyə buyurdu. Onlar: «Dörd xüsusiyyət barəsində bizə xəbər ver: Tövrat nazil olmamışdan əvvəl İsrail (Yəqub – *əleyhissəlam* – ) özünə nəyi haram etmişdir? Kişinin belindən və qadının köksündən gələn suyun keyfiyyəti necədir və necə olur ki, uşaq oğlan olur? Yazıb oxumağı bacarmayan peyğəmbər necə yatır və hansı mələk onun sevimli dostudur?» dedilər. Peyğəmbər: «Dediklərinizə doğru cavab versəm Allah qarşısında verdiyiniz vədi yerinə yetirmək və mənə tabe olmaq sizə vacib olacaqdır» deyə buyurdu. Onlar bir daha öz vədlərini təsdiqlədilər. Peyğəmbər: «Tövratı Musa – *əleyhissəlam* – nazil edən Allaha and verirəm ki, Yəqub – *əleyhissəlam* – çox şiddətli xəstəliyə tutulmuş (oturaq sinirindən şikayət edirdi) və xəstəliyi uzun müddət davam etdiyinə görə Allaha nəzir etmişdir ki, əgər ona şəfa versə ən sevimli yeməyini və ən sevimli içkisini özünə haram edəcəkdir. Onun ən sevimli yeməyi dəvə əti və onun südüdür» deyə buyurdu. Onlar: «Allaha and olsun ki, bu belədir!» dedilər. Peyğəmbər: «Allahım sən onların dediklərinə şahid ol! Sonra Tövratı Musa – *əleyhissəlam* – nazil edən, heç bir şəriki olmayan Allaha and verirəm ki, kişinin belindən gələn su ağ rəngli qatı maye qadının köksündən gələn su isə sarı rəngli duru mayedir. Bunlardan hansı üstünlük təşkil etsə uşaq Allahın izni ilə üstünlük təşkil edənin cinsindən olar və ona oxşayar. Kişinin belindən gələn su üstünlük təşkil etsə Allahın izni ilə oğlan uşağı, qadının köksündən gələn sustünlük təşkil etsə Allahın

[1498] Buxari 3245, Müslim 2834.
[1499] Əhməd 3/316.
[1500] Müslim 315.

izni ilə qız uşağı doğular» deyə buyurdu. Onlar: «Allaha and olsun ki, bu belədir» dedilər. Peyğəmbər: «Allahım sən onların dediklərinə şahid ol! Sonra Tövratı Musa – *əleyhissəlam* – nazil edən Allaha and verirəm ki, yazıb-oxumağı bacarmayan Peyğəmbərin gözləri yatır, qəlbi isə oyaq qalır» deyə buyurdu. Onlar: «Allaha and olsun ki, bu belədir» dedilər. Onlar: «İndi isə mələklərdən hansının sənin sevimli dostun olduğu barədə bizə xəbər ver, bununla da səni biz ya sənə tabe olaq, ya da səni tərk edək» dedilər. Peyğəmbər: «Həqiqətən də mənim sevimli dostum Cəbrail – *əleyhissəlam* – dır. Allah elə bir Peyğəmbər göndərməyib ki, Cəbrail – *əleyhissəlam* – onun dostu olmasın» deyə buyurdu. Onlar: «Bu yerdə səni tərk etməli olacağıq. Əgər sənin dostun o, yox başqa mələk olsaydı dediyini təsdiq edərdik və sənə tabe olardıq» dedilər. Peyğəmbər: «Sizə dediyimi təsdiq etməyə mane olan nədir?» deyə buyurdu. Onlar: «O, bizim düşmənimizdir (Başqa rəvayətdə: Bizim düşmənimiz olan. Əzab, ölüm və müharibə gətirən Cəbrail: Əgər rəhmət, bitki və yağış gətirən Mikail desəydin doğru olardı) dedilər. Bu zaman ayə nazil oldu: ***«****(Ya Muhəmməd!)* ***De: «Kim Cəbrailə düşməndirsə*** *(onu yaxşı bilsin ki)* ***həqiqətən o, özündən əvvəlkiləri*** *(Tövratı və İncili)* ***təsdiq edən, möminləri doğru yola yönəldən,*** *(onlara)* ***müjdə verən Quranı Allahın izni ilə sənin qəlbinə çatdırmışdır».*** *(əl-Bəqərə 97).* (Başqa rəvayətdə: Onlar: «Bizə ildırım haqqında xəbər ver!» dedilər. Peyğəmbər: «Bu Allahın buludları idrə etmək üçün müvəkkəl etdiyi bir məlәkdir ki, əlindəki oddan olan ***Mixraqla –*** buludları dağıdaraq Allahın əmr etdiyi yerə aparır» deyə buyurdu. Onlar: «Bəs eşidilən gurultu nədir?» dedilər. Peyğəmbər: «Onun səsidir» deyə buyurdu»)[1501]. Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Abdullah b. Səlam, Rəsulullah - *sallallahu aleyhi və səlləm* – in Mədinəyə gəldiyini eşidir. Rəsulullah - *sallallahu aleyhi və səlləm* – in yanına gələrək: Səndən üç şey barəsində soruşacağam ki, bunu Peyğəmbərlərdən başqa heç kəs bilməz. Qiyamət əlamətlərinin ilk olanı hansıdır? Cənnət əhlinin ilk yeməyi hansıdır? Uşaq atasına və ya anasına nə üçün oxşayar? Peyğəmbər: "Cəbrail onları mənə xəbər verdi" deyə buyurdu. Abdullah: "Cəbrailmi?" dedim. Peyğəmbər: "Bəli" deyə buyurdu. Mən: "Bu Yəhudilərin düşməni olan mələkdir" dedim. Peyğəmbər: ***"****(Ya Rəsulum!)* ***Cəbrailə düşmən olan kimsəyə de ki, onu*** *(Quranı)* ***özündən əvvəlkiləri*** *(Tövratı və İncili)* ***təsdiqləyici, möminlər üçün isə hidayət və müjdəçi olaraq Allahın izni ilə sənin qəlbinə o nazil etmişdir".*** *(əl-Bəqərə 97).* Qiyamət əlamətlərinin ilk olanı: Atəşdir – hansıki insanları şərqdən qərbə tolayar. Cənnət əhlinin yeyəcəyi ilk yemək balıq ciyəridir. Kişinin suyu (məni) qadının suyunu üstəliyərsə uşaq ataya, qadının suyu kişinin suyunu üstəliyərsə uşaq qadına oxşayar. Abdullah: "Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına və sənin də Allahın Rəsulu olduğuna şəhadət edirəm. Ya Rəsulullah! Yəhudilər yalançı – bir toplumdur. Əgər onlar sən məni onlardan soruşmadan öncə müsəlman olduğumu bilsələr mənə iftira atarlar". Bir müddətdən sonra Yəhudilər gəldilər. Peyğəmbər: "İçinizdə Abdullahı kim tanıyır" deyə soruşdu. Onlar: "Xeyirlimizdir, xeyirlimizin oğludur, Seyyidimizdir, seyyidimizin oğludur" dedilər. Peyğəmbər: "Müsəlman olarsa nə deyirsiniz?". Onlar: "Allah onu bundan qorusun" dedilər. Abdullah çıxaraq: "Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına və Muhəmmədin Allahın Rəsulu olduğuna şəhadət edirəm" dedi. Yəhudilər onu pisləyərək: "Ən pis olanımız, ən pisimizin oğlu" dedilər. Abdullah: "Qorxduğum da bu idi Ya Rəsulullah!" dedim[1502].

---

[1501] Əhməd 1/274,278.
[1502] Buxari 8/165.

***Cənnətin Qapıları: «Qapıları onların üzünə açılmış Ədn cənnətləri».*** *(Sad 50).* ***«Özlərinin, həmçinin əməli saleh ataları, zövcələri və övladlarının daxil olacaqları Ədn Cənnəti gözləyir. Mələklər də hər bir qapıdan daxil olub onlara: «Səbr etdiyinizə görə sizə salam olsun».*** *(ər-Rəd 23.24).* Səhl b. Sad – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnətdə səkkiz qapı vardır. Bunların arasında Rəyyan deyilən bir qapı vardır ki, bu qapıdan yalnız oruc tutanlar daxil olacaqdır (Başqa rəvayətdə: Sədəqə verən sədəqə qapısından, namaz qılanlar namaz qapısından, mücahidlər cihad qapısından Cənnətə daxil olarlar…)»[1503]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Ramazan gəldikdə Cənnətin qapıları açılar, Cəhənnəm qapıları bağlanar və şeytanlar zəncirlənərlər»[1504]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «…Cənnətin qapı qanadlarının iki qanadı arası Məkkə ilə Həcər yaxud da Məkkə ilə Busra arası qədər genişdir (Başqa rəvayətdə: Cənnətin qapıları arasındakı məsafə qırx illik yoldur [1505] )» [1506] . ***"Rəbbindən qorxanlar da dəstə-dəstə Cənnətə gətiriləcəklər. Nəhayət, ora çatınca onun qapıları açılacaq və*** *(cənnət)* ***gözətçiləri*** *(onlara)**:* ***"Salam aleykum!*** *(Sizə salam olsun!)* ***Xoş gəldiniz! Əbədi qalacağınız Cənnətə daxil olun!" – deyəcəklər".*** *(əz-Zumər 73).* Ömər b. Xattab - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Sizdən bir kimsə gözəl bir şəkildə (kamil) dəstəmaz alarsa və sonra: Şəhadət edirəm ki, Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur və Muhəmməd onun qulu və Rəsuludur – deyərsə ona Cənnətin səkkiz qapısı aşılar və hansından istəyirsə daxil olar"[1507]. Əbu Şeyh deyir ki, əl-Fəzari dedi ki: "Cənnətdə hər möminin dörd qapısı vardır. Bir qapıdan onu ziyarətə gələn mələklər girər, bir qapıdan yoldaşları olan hurilər girər, bir qapı onunla Cəhənnəm arasındadır. Dilədiyi zaman açar baxar və ona olan nemətin böyüklüyünü başa düşər. Digər bir qapı da onunla ***Darus Səlam*** arasında olan qapıdır. İstədiyi zaman Rəbbinin hüzuruna girər"[1508]. Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: "Cənnət qapısının halqasını ilk tutan mənəm. Lakin öyünmürəm"[1509].

***Cənnətin Dərəcələri: «Kim Rəbbinin hüzuruna iman gətirib yaxşı əməllər etdiyi halda gələrsə, belələrini ən yüksək dərəcələr gözləyir».*** *(Ta ha 75). «(Ya Peyğəmbərim!)* ***Bir gör var-dövlət, cah-cəlal baxımından*** *(dünyada)* ***onların birini digərindən necə üstün etdik. Axirətdə isə daha yüksək dərəcələr, daha böyük üstünlüklər vardır».*** *(əl-İsra 21).* Muğira b. Şöbə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Musa: «Ya Rəbbim! Cənnət əhlinin ən aşağı mənzili hansıdır?» deyə buyurdu. Allah: «Bu o, kimsənin məqamıdır ki, o kimsə Cənnət əhli Cənnətə girdikdən sonra gəlir ona: «Cənnətə gir deyirlər». O isə: «Ey Rəbbim! Hər kəs öz mənzilinə yerləşdikdən sonra, olacağını aldıqdan sonra bu necə müyəssər ola bilər?» deyər. Allah: «Dünya Məliklərindən bir məlikin mülkünə bənzər bir mülkə nail olsan razı qalarsanmı?» deyə buyurdu. O: «Razı qalaram ya

---

[1503] Buxari 1896,3257,3666, Müslim 1152.
[1504] Buxari 1898.
[1505] Müslim «Zuhd» 3/14, 2967, Əhməd 5/3, Heysəmi "Məcmuaz Zəvaid" 10/397.
[1506] Müslim 327, Buxari 4712.
[1507] Müslim 234.
[1508] Əbu Nuaym "Sifatul Cənnəh" 2/18-19.
[1509] Əbu Nuaym "Sifatul Cənnəh" 2/28.

Rəbbim!» dedi. Allah: «O, mülk qədəri sənindir, bir o, qədər də sənindir, bir o, qədər də sənindir, beşinci dəfə (qul): «Razıyam ya Rəbbim!» deyər. Allah: «O, qədəri də sənindir, onun on misli də sənindir. Bir də nəfsinin istədiyi, gözün nədən xoşlanırsa hamısı da sənindir» deyə buyurar. O, qul: «Razı oldum, ya Rəbbim! Razı oldum» deyər. Bu cavabdan sonra Musa: «Ya Rəbbim! Bəs Cənnət əhlinin ən yüksək məqam sahibləri?» deyə buyurar. Allah: «Onları özüm üçün seçdim və fəzilətli qullar onlardır. Kəramətlərini öz əlimlə tikib, möhür altına aldım. Onu nə bir göz görmüş, nə də bir qulaq eşitmiş, nə də bəşər övladlarından heç birinin qəlbi o, şeylər barədə düşünmüşdür…»[1510].

***Cənnətə Girənlərin Vəsfi:*** Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnətə bir sıra qövmlər girər ki, onların qəlbləri quşların qəlbləri kimidir» . Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnət əhli cənnətə girincə bir carçı səsləyərək: «Sizlər üçün əbədi bir həyat vardır, əsla ölməyəcəksiniz. Sizin üçün elə bir səhhət vardır ki, əbədi olaraq xəstələnməyəcəksiniz. Sizin üçün əsla ixtiyarlanmayacağınız bir gənclik vardır. Sizin üçün heç bir sıxıntı və darlığa düşməyəcəyiniz əbədi nemət vardır» . Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Allah Adəmi öz surətində yaratdı. Boyu altımış dirsək idi. Sonra ona: «Get mələklərin yanına onlar səni necə salamlayarlarsa bu da sənin zürriyətinin salamı olacaqdır». Adəm onların yanına gələrək: «***Əssələmu Aleykum***» dedi. Mələklər də: «***Əssələmu Aleyyə Və Rahmətullah***» deyə cavab verdilər. Cənnətə girən hər bir kəs Adəmin bu surətində girəcəkdir. Boyu altımış dirsək. (Ondan sonra isə insanlar indiyə kimi cılızdaşmağa doğru gedirlər)[1513]. Əli - *radıyallahu anhu* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Cənnətdə bir bazar vardır ki, orada alış-veriş yoxdur. Sadəcə qadınlardan və kişilərdən surətlər vardır. Adam bir surəti arzuladığı zaman o surətin içinə girər"[1514].

***Cənnət Əhlinin Bir-Birləri İlə Görüşmələri Və Dünyanı Xatırlamaları: «Onlar*** *(dünyada gördükləri işlər barəsində)* ***bir-birindən hal-əhval tutmağa başlayacaqlar».*** *(ət-Tur 25).* ***«Onlar bir-biri ilə*** *(dünyada gördükləri işlər barədə)* ***sorğu-suala, söz-söhbətə başlayacaqlar. Onlardan bir belə deyəcəkdir: «Mənim bir yoldaşım var idi. O, deyərdi: «Sən doğurdan da inanırsan ki, biz öldükdən, torpaq və sümük olduqdan sonra*** *(dirilib)* ***sorğu-sual olunacaq və əməllərimizə görə cəzalandırılacağıq?».*** *(Sonra həmən şəxs Cənnətdəki yoldaşlarına)* ***deyəcək: «Siz*** *(indi onun nə halda olduğunu)* ***bilirsinizmi?».*** *(Onlar xeyr – deyə cavab verərlər).* ***O, özü baxıb*** *(yoldaşını)* ***Cəhənnəmin ortasında görəcəkdir. Və*** *(ona üz tutub)* ***deyəcəkdir: «Allaha and olsun ki, sən az qala məni*** *(yoldan çıxarıb)* ***məhv edəcəkdin! Əgər Rəbbimin lütfü olmasaydı mən də*** *(Cəhənnəmə)* ***gətrilənlərdən olardım! Biz artıq ölməyəcəyik, elə deyilmi?*** *(Dünyadakı)* ***ilk ölümümüz istisna olmaqla Biz əzab da görməyəcəyik! Həqiqətən bu böyük qurtuluş və uğurdur. Qoy*** *(dünyada)* ***çalışanlar bunun üçün çalışsınlar!».*** *(əs-Saffət 50-61).* Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «İnsan yoldaşının dinindədir. Buna görə də kiminlə yoldaşlıq etdiyinizə diqqət

---

1510 Müslim 311.
1511 Müslim 2840.
1512 Müslim 2837.
1513 Müslim 2841.
1514 Tirmizi 2550, Nihayə 2/490-491, Tərğib vət Tərhib 4/541.

edin»[1515]. Əbu Umamə - *radıyallahu anhu* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən: "Cənnət əhli bir-birilərini ziyarət edərlərmi?". O: "Üstə olan aşağıda olanı ziyarət edər, aşağıda olan üstə olanı ziyarət edə bilməz. Allah üçün sevənlərdən başqa. Onlar Cənnətdə istədikləri yerə dəvələr üstündə girərlər"[1516].

***Cənnət Əhlinin Cəhənnəmliklərə Gülmələri: Cənnət əhli Cəhənnəm əhlinə müraciət edib: "Biz Rəbbimizin bizə vəd etdiyini*** *(axirət nemətlərini)* ***haqq olaraq gördük. Siz də Rəbbinizin sizə vəd etdiyini*** *(Cəhənnəm əzabını)* ***gerçək olaraq gördünüzmü?" – deyə soruşacaq. Onlar: "Bəli!" – deyə cavab verəcəklər. Elə bu zaman onların*** *(hər iki dəstəsinin)* ***arasında bir carçı*** *(İsrafil və ya cənnətdəkilərdən biri)****: "Allah zalımlara lənət eləsin!" – deyə səslənəcək. O kəslər ki, insanları Allah yolundan döndərər, onu*** *(Allah yolunu)* ***əyri hala salmaq*** *(əymək)* ***istəyər və axirətdə də inkar edərlər!" Onların ikisinin*** *(cənnət əhli ilə cəhənnəm əhlinin)* ***arasında pərdə*** *(səs, maneə)* ***və Əraf*** *(Cənnətlə Cəhənnəm arasındakı səddin yüksəklikləri)* ***üzərində isə*** *(savabları və günahları, xeyir və şər əməlləri bərabər olan)* ***insanlar*** *(kişilər)* ***vardır ki, onlar hamını*** *(cənnətlikləri və cəhənnəmlikləri)* ***üzündən tanıyıb cənnət əhlinə: "Sizə salam olsun!" - deyə müraciət edərlər. Bunlar*** *(əraf əhli)* ***çox istədiklərinə baxmayaraq hələ ora*** *(Cənnətə)* ***daxil olmamış*** *(lakin Ərafda günahları təmizləndikdən sonra daxil olacaq)* ***kimsələrdir. Onların nəzərləri cəhənnəm əhlinə çevrildiyi zaman: "Ey Rəbbimiz! Bizi zalımlarla bir etmə!" - deyərlər. Əraf əhli üzlərindən tanıdıqları adamlara müraciət edib: "Sizə nə yiğdığınız mal-dövlət, nə də təkəbbürünüz fayda verdi", - deyəcək.*** *(Və fağır, yoxsul möminləri kafirlərin böyüklərinə göstərərək:)* ***"Allah onları Öz mərhəmətinə nail etməyəcək, -deyə and içdiyiniz kəslər bunlarmıdır?" – söyləyəcəklər.*** *(O anda Allah həmin möminlərə müraciətlə belə buyuracaq)* ***"Cənnətə daxil olun. Sizin heç bir qorxunuz yoxdur və siz qəm-qüssə görməyəcəksiniz!" Cəhənnəm əhli cənnət əhlinə müraciət edib: "Üstümüzə bir az su tökün və ya Allahın sizə verdiyi ruzilərdən bizə bir qədər ehsan edin!" – deyəcək. Onlar isə: "Doğrusu, Allah bunları kafirlərə haram buyurmuşdur!" – deyə cavab verəcəklər».*** *(əl-Əraf 44-50).* ***«Həqiqətən günahkarlar iman gətirmiş kimsələrə*** *(dünyada)* ***gülürdülər. Möminlərin yanından keçərkən*** *(onları dolamaq məqsədi ilə)* ***bir-birinə göz-qaş edirdilər. Ailələrinin yanına qayıtdıqda isə*** *(onları doladıqları üçün)* ***kefləri kök qayıdardılar. Möminləri gördükdə: «Doğrusu bunlar*** *(haqq yoldan)* ***azanlardır!» deyərdilər. Halbuki onlar möminlərə nəzarətçi göndərilməmişdilər. Bu gün isə möminlər kafirlərə güləcəklər».*** *(əl-Mutəffifin 29-34).*

***Cənnətə Kasıbların Daha Tez Daxil Olmaları:*** Abdullah b. Amr – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Şübhəsiz ki, mühacirlərin fəqirləri Qiyamət günü Cənnətə varlılardan **40** il tez girəcəklər (Başqa rəvayətdə: Varlılar kasıblardan beş yüz ildən sonra Cənnətə girərlər (Yarım gün öncə (dünya günləriylə **500**) il edər[1517])[1518])»[1519]. Ənəs - *radıyallahu anhu* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – belə dua etdi: "Allahım məni miskin olaraq yaşad, miskin olaraq öldür, Qiyamət günü də miskinlər zümrəsində həşr et". Aişə: "Nə üçün (Miskin) Ya Rəsulallah!" deyə soruşdum. O: "Çünki onlar zənginlərdən **40** il

---

[1515] əl-Albani «Səhihul Cəmi» 3539.
[1516] Heysəmi "Məcmuaz Zəvaid" 10/279, Əbu Nuaym "Sifatul Cənnəh" 422.
[1517] Əbu Davud "Elm" 13, 3666, Tirmizi "Zuhd" 37, 2352.
[1518] Tirmizi "Zuhd" 37, 2354, İbn Məcə «Zuhd» 2/6.
[1519] Müslim 2979.

öncə Cənnətə girəcəklər. Ey Aişə! Fəqirləri sev, onları (məclisinə) yaxınlaşdır ta ki, Qiyamət günü də Allah sənə yaxınlaşsın"[1520]. ***Fayda:*** Onların öncə girmiş olmaları dərəcələrinin daha üstün olması demək deyildir. Çünki sonra girən öncə girəndən daha üstün ola bilər.

***Cəhənnəmdən Cənnətə Daxil Olanlar:*** İmran b. Hüseyn – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Mənim şəfaətim ilə bir qövm Cəhənnəmdən çıxarılıb Cənnətə daxil ediləcəkdir. Onlar Cəhənnəmliklər – deyə adlandırılacaqlar»[1521]. İbn Məsud – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Mən Cəhənnəm əhlinin Cəhənnəmdən son çıxacaq və Cənnət əhlinin Cənnətə son girəcək olanını bilirəm. Bu o kimsədir ki, Cəhənnəmdən sürünə-sürünə çıxar. Allah: «Get Cənnətə gir!» deyə buyurar. O, kimsə Cənnətə yaxınlaşar və ona elə gəlir ki, cənnət artıq dolmuşdur. O: «Ya Rəbb! Mən Cənnəti dolmuş gördüm!» deyər. Allah: «Get Cənnətə gir! Dünya qədər və dünyanın on misli qədər yer sənindir» deyə buyurar. Qul: «Sən, Aləmlərin Rəbbi olduğun halda mənimlə zarafat edirsən (mənə gülürsən)?» deyər. Hədisi rəvayət edən deyir ki: «Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – bunu deyərkən arxa dişləri görünənə qədər güldü» dedi. Cənnət əhlinin ən aşağı sakini bu kimsədir»[1522]. Əbu Zərr – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: "Mən Cənnət əhlindən Cənnətə ən son girəcək olanı, Cəhənnəm əhlinin oradan ən son çıxacaq olanı tanıyıram. Bu o, kimsədir ki, Qiyamət günü gətirilir və ona kiçik günahları ərz edilir (göstərilir), böyük günahları isə (göstərilmir). Ona sən filan-filan günü bu əməli etdin, filan-filan günü də bu əməli etdi – deyilir. O, da bəli deyir. Böyük günahların göstəriləcəyi qorxusu və sıxıntısı onu kiçikləri inkar etməyə gücü çatmır. Etdiyin hər bir pisliyə qarşı sənə bir həsənə vardır. Adam: Ya Rəbbim! Mən başqa günahlarda etmişəm lakin burada onları görmürəm" deyər. Əbu Zərr: "Rəsulullah - *sallallahu aleyhi və səlləm* – i gördüm ki, gülür. Elə güldüki arxa dişləri göründü" dedi[1523]. İbn Məsud – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: "Cənnətə girən son kimsə Sırat üzərində gah yürüyər, gah üzüüstə sürünə, gah da atəş üzünü yandırar. (Sıratı) keçdikdən sonra dönüb: Məni səndən qurtaran (Allah) mübarək və ucadır. Allah mənə elə bir şey ehsan etmişdir ki, nə öncəkilərdən, nə də sonrakılardan heç kimə ehsan etməmişdir. Ona bir ağac göstərilir: Ey Rəbbim! Məni bu ağaca yaxınlaşdır, kölgəsində kölgələnim, suyundan içim" deyər. Allah: "Ey Adəm oğlu! Mən sənə istədiyini versəm məndən başqa şey istəməzsən". Adam: "Xeyr, Ya Rəbbim! (Allaha and olsun ki, istəmərəm)" deyəcək və bundan başqa bir şey istəməyəcəyinə dair Allaha söz verir. Allah onu məzur görür. Çünki o, kimsə səbr edə bilməyəcəyi bir şeyi görmüşdür. Onu ağaca yaxınlaşdırır. O, da ağacın kölgəsində kölgələnir və suyundan içir. Sonra ona birincidən daha gözəl bir ağac göstərilir və bu kimsə: "Ya Rəbbim! Məni bu ağaca yaxınlaşdır. Kölgəsində kölgələnim və suyundan içim. Bundan başqa səndən bir şey istəməyəcəyəm" deyər. Allah: "Ey Adəm oğlu! Məndən başqa bir şey istəməyəcəyinə söz vermədinmi? Səni bu ağaca yaxınlaşdırsam başqa şey də istəyəcəksən Məndən" deyər. Adam başqa bir istəməyəcəyinə dair Allaha söz verir. Allah onu məzur görür. Çünki o, kimsə səbr edə

[1520] Tirmizi "Zuhd" 2353, 2355.
[1521] Buxari 6566.
[1522] Buxari 6571, 7511, Müslim 314.
[1523] Müslim 190.

bilməyəcəyi bir şeyi görmüşdür. Onu ağaca yaxınlaşdırır. O, da ağacın kölgəsində kölgələnir və suyundan içir. Sonra Cənnət qapısının yanında ona əvvəlkindən daha gözəl bir ağac göstərilir o: "Ya Rəbbim! Məni bu ağaca yaxınlaşdır. Kölgəsində kölgələnim və suyundan içim. (Əmin olun) Bundan başqa Səndən bir şey istəməyəcəyəm" deyər. Allah: "Ey Adəm oğlu! Məndən başqa bir şey istəməyəcəyinə söz vermədinmi?". Adam: "Bəli, Ya Rəbbim! Lakin bu ən axırıncı istək olsun. Səndən başqasını istəmərəm" deyəcək. Allah onu yenə də məzur görür. Çünki o, kimsə səbr edə bilməyəcəyi bir şeyi görmüşdür. Buna görə də Allah onu ağaca yaxınlaşdırır. (Bu dəfə) Cənnətliklərin səsini eşidir: "Ya Rəbbim! Məni ora sal" deyər. Allah: "Ey Adəm oğlu! Məndən nə istəyirsən? Sənə bir dünya və onun mislini versəm razı olarsanmı?" deyə buyurar. Adam: "Ya Rəbbim! Sən aləmlərin Rəbbi olduğun halda mənimlə zarafatmı edirsın?" deyər. Bu vaxt İbn Məsud – *radıyallahu anhu* – gülməyə başladı. Orada olanlar səbəbini soruşduqda o: "Rəsulullah - *sallallahu aleyhi və səlləm* – belə gülmüşdü və səhabələr: "Nə üçün gülürsən Ya Rəsulullah!" dedikdə o: "Bu adam: Ya Rəbbim! Sən aləmlərin Rəbbi olduğun halda mənimlə zarafatmı edirsın?" dediyi zaman Rəbbul Aləmin güldüyü üçün gülürəm" deyə buyurdu. Allah: "Mən səninlə zarafat etmirəm, lakin mən dilədiyimi etməyə qadirəm" deyə buyurdu[1524]. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «…Allah öz qulları üzərində haqq-hesabı çəkib bitirdikdən sonra Cənnət ilə Cəhənnəm arasında bir nəfər qalır. Bu kimsə Cənnətə girən ən son Cəhənnəmlik olacaqdır. (Başqa rəvayətdə: «Bu kimsə Cənnət əhlinin Cənnətə ən son girəni olacaqdır»). Onun üzü Cəhənnəmə tərəf yönəlmiş olacaqdır. O, kimsə: «Ya Rəbbim! Üzümü Cəhənnəmdən çevir onun isti küləyi (qoxusu) məni zəhərləyib öldürür, atəşi isə məni yandırır». Allah: «Əgər sənin istədiyin yerinə yetsə bundan sonra məndən başqa bir şey istəyəcəksənmi?» deyə buyurur. O, kimsə: «İzzətinə and olsun ki, xeyr!» deyərək Allaha (bu işdə) and və söz verir. Allah onun üzünü Cəhənnəm atəşindən çevirir. O, kimsə üzünü Cənnətə tərəf çevirdikdə oranın gözəlliyini görüb Allahın dilədiyi müddət qədər susduqdan sonra: «Ey Rəbbim! Məni Cənnətin qapısına yaxınlaşdır» deyir. Allah: «Məgər sən and içməmişdin ki, Məndən bu istədiyindən başqa bir şey istəməyəcəksən?». O, kimsə: «Ey Rəbbim! Yaratdıqlarının ən bədbəxti olmamaqdan ötrü!» deyir. Allah: «Əgər sənin bu istədiyin də yerinə yetsə bundan sonra məndən başqa bir şey istəyəcəksənmi?» deyə buyurur. O, kimsə: «İzzətinə and olsun ki, xeyr!» deyərək Allaha (bu işdə) and və söz verir. Allah onu Cənnətin qapısına yaxınlaşdırır. O, kimsə Cənnətin qapısına yaxınlaşdıqda orada olan gözəlliyi, içindəki sevinci və rəngarəngliyi gördükdə Allahın dilədiyi müddət qədər susduqdan sonra: «Ey Rəbbim! Məni Cənnətə sal!» deyir. Allah: «Vay sənə ey Adəm oğlu! Nə qədər sən öz sözündən dönürsən! Məgər sən and içməmişdin ki, Məndən bu istədiyindən başqa bir şey istəməyəcəksən?». O, kimsə: «Ey Rəbbim! Məni yaratdıqlarının ən bədbəxti etmə!» deyəcəkdir. Allah gülər və ona Cənnətə girməyə izn verər və ona: «Dilədiyini istə!» buyurar. O, da arzuladığı şeyləri tükənənə qədər istəyəcəkdir. Arzuladığı şeylər tükəndikdən sonra Allah: «Bunu da, bunu da (əlavə et) buyuraraq ona istədiklərini xatırladacaqdır. Sonda bütün istədikləri bitdikdən sonra Allah: «Bunların hamısı və bir o, qədər də sənindir!» deyə buyurur[1525].

---

[1524] Müslim 187.
[1525] Buxari, Müslim.

***Cənnətliklər Yatmazlar: «Orada bizə nə bir yorğunluq, nə də bir məşəqqət, əziyyət toxunacaqdır».*** *(Fatir 35)*. Cabir – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Yatmağ ölümün qardaşıdır və Cənnətliklər yatmazlar» .

***Cənnətin Vəsfi:*** Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Nəfsim əlində olana and olsun ki, əgər siz mən görənləri görsəydiniz az gülər çox ağlayardınız». Səhabələr: «Ya Rəsulullah! Sən nə gördün?» deyə soruşdular. Peyğəmbər: «Mən Cənnət və Cəhənnəmi gördüm» deyə buyurdu . İmran b. Huseyn – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnətin ən az sakini qadınlardır» . Aişə – *radıyallahu anhə* – rəvayət edir ki, günəş tutuldu. Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «…Mən vəd olunduğunuz hər şeyi gördüm. Hətta irəliyə doğru getməyə başladığımı gördüyünüz vaxt Cənnətdən bir salxım almaq istədim (Başaqa rəvayətdə: Əgər o, salxımı dərə bilsəydim dünya durduqca ondan yeyərdiniz (heç qurtarmazdı). Məni geriyə çəkildiyimi gördüyünüz vaxt Cəhənnəmi gördüm. Bu gün kimi ömrümdə qorxulu bir mənzərə görməmişdim…» . Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Üç övladı ölən hər bir qadının bu övladları onu Cəhənnəmdən qoruyan bir pərdə olacaqdır». Qadınlardan biri: «İki övladı ölsə necə?» deyə soruşdu. Peyğəmbər: «Bəli iki övladı ölsə də!» deyə buyurdu . Cabir – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnət əhli kimsələr yeyib içərlər lakin böyük-kiçik ayaqyoluna çıxmazlar, burun suyu və tüpürməzlər. Yeyəcəkləri bir misk kimi bir tərləmə və gəyirməklə çölə çıxar (Başqa rəvayətdə: Onların əxlaqı bir tək adamın əxlaqıdır. Onların surəti də Adəmin surətidir ki, onun boyu altımış dirsəkdir o, səmadadır )» . Abdullah b. Amr – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Bir kimsə atasından başqa bir adamın oğlu olduğunu iddia edərsə Cənnətin iyini belə hiss etməz. O, Cənnət ki, iyi qırx (yetmiş) illik məsafədən hiss edilir» . Abdullah b. Amr – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Bir zimmini öldürən Cənnətin iyini belə almaz. Cənnətin iyi isə qırx illik məsafədən hiss edilir» . Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «İnsanı ən çox Cəhənnəmə salan cinsi orqanı və dilidir, ən çox da Cənnətə salan Allaha qarşı çıxmaqdan çəkinmək və gözəl əxlaqdır» . Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnət əhlinin uşaqları olmaz» . İbn Abbas rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - buyurdu: «***Həcərul Əsvəd*** – qara daş Cənnətdən idi. Endiyi vaxt süddən ağ idi. Onu insanların günahları qaraltdı» . Əbu

---

[1526] Heysəmi «Məcmua Zəvaid» 10/415.
[1527] Müslim 426.
[1528] Müslim 2738.
[1529] Buxari 1212, Müsllim 901.
[1530] Buxari 1249.
[1531] Buxari 3245, Müslim 2834.
[1532] Əhməd 3/316.
[1533] Əhməd 2/171.
[1534] ***Zimmi*** – müsəlman olmayıb müqavilə ilə müsəlman ölkəsində yaşayan şəxs (Kitab əhli, kafir və s).
[1535] Buxari 8/30.
[1536] Əhməd 2/291.
[1537] Tirmizi 2566.
[1538] Tirmizi 877.

Umamə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Kim haqsız olduğu halda münaqişəni tərk edərsə ona Cənnətin kənarında bir ev qurular, kim də haqlı olduğu halda münaqişəni tərk edərsə ona Cənnətin ortasında bir ev qurular, kim də əxlaqını gözəl edərsə ona Cənnətin ən uca yerində bir ev qurular» . Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Sizə Cənnət əhlindən xəbər verimmi?». Səhabələr: «Bəli, ya Rəsulullah!» dedilər. Peyğəmbər: «Hər zəif olan, xalq tərəfindən zəif görünən hər bir mömin Cənnətlikdir. O, mömin Allaha and içsə heç şübhəsiz ki, Allah onun andını haqq edər» deyə buyurdu. Sonra da: «Sizə Cəhənnəm əhlindən xəbər verimmi?» deyə buyurdu. Səhabələr: «Bəli, ya Rəsulullah!» dedilər. Peyğəmbər: «Hər daş qəlbli, zorba, xeyirə mane olana, zülümkara, hiyləgərə, anlamaza» deyə buyurdu . ***«Və həm də itaət etmə*** *(yalan yerə)* ***hər and içənə, alçağa, qeybət edənə, söz gəzdirənə, xeyirə mane olana, həddi aşana, günaha batana, daş ürəkliyə, anlamaza və eyni zamanda əsli-nəsəbi bilinməyən haramzadaya. O, mal-dövlət, oğul-uşaq sahibi olsa belə, ayələrimiz ona oxunduğu zaman o: «****(Bunlar)* ***qədimlərin uydurduğu əfsanədir!» dedi. Biz onun burnuna damğa basacağıq».*** *(Nun 10-16).* Sad b. Əbu Vaqqas – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Sizə ancaq zəiflərin duası sayəsində yardım edilir və ruziləndirilirsiniz» . Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Qapılardan qovulan saçı dağınıq bəzi kimsələr vardır ki, Allaha and içsələr heç şübhəsiz ki, Allah onların andını doğru çıxarar» . İbn Məsud – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Cənnət sizin hər birinizə onun ayaqqabılarının bağından da (kəmərindən də) ona yaxındır. Həmçinin Cəhənnəmdə» .

## ŞƏFAƏT

***Şəfaət*** **–** vasitə hər hansı bir şeyi tələb etmək deməkdir. İstilahi mənası isə kimin üçünsə xeyr diləmək, şərr və əzabdan uzaq etmək deməkdir. Allah Qurani Kərimdə bir çox ayələrdə şəfaətin yalnız ona məxsus olduğunu və heç kimsənin bu işdə hər hansı bir payı olmadığını bizə bildirir. ***«Yoxsa onlar*** *(müşriklər)* ***Allahdan qeyrilərini*** *(bütləri)* ***şəfaətçi etdilər?*** *(Ya Peyğəmbər!)* ***de ki: «Onlar heç bir şeyə malik olmadıqları və heç bir şey qanmadıqları halda şəfaətmi edəcəklər?». De ki: «Bütün şəfaət yalnız Allaha məxsusdur. Göylərin və yerin hökmü onun əlindədir. Sonra siz onun hüzuruna qaytarılacaqsınız».*** *(əz-Zumər 43-44).*

Nə zaman olacağına gəlincə, Uca Allah bizə şəfaətin ancaq onun izni ilə olacağına xəbər vermişdi. ***«Allahın izni olmadan onun yanında kim şəfaət edə bilər».*** *(əl-Bəqərə 255).* ***Onun izni olmadan heç bir şəfaət edən ola bilməz».*** *(Yunus 3).* ***«Axirət də, dünya da ancaq Allahındır. Göylərdə neçə-neçə mələklər vardır ki, onların şəfaəti heç bir fayda verməz. Ancaq Allah öz istədiyi və razı olduğu kimsəyə izn verdikdən sonra*** *(onun şəfaəti fayda verər)****».*** *(ən-Nəcm 25-26).* ***«Onun hüzurunda izn verdiyi kimsələr istisna olmaqla heç kəsin şəfaəti fayda verməz».*** *(Səba 23).*

[1539] Tirmizi 1994, Əbu Davud 4800.
[1540] Müslim 2853.
[1541] Buxari 4/104-108.
[1542] Müslim 2854.
[1543] Buxari «Kitabu Rikak».

Kimlərin şəfaət edəcəyinə gəlincə isə, Uca Allah bizlərə şəfaətin ancaq onun izn verməsindən sonra gerçəkləşəcəyini xəbər verdiyi kimi, bu xüsusta ancaq onun sevdiyi kimsələrin şəfaət edəcəyini də xəbər vermişdir. ***«Ruhun** (Cəbrailin) **və mələklərin səf-səf duracağı gün Rəhmanın izn verdiyi kimsələrdən başqa heç kəs danışmayacaq, danışan da doğrunu deyəcəkdir».** (ən-Nəbə 38). **«Allahdan əhd almış kəslər müstəsna olmaqla, qalanları** (kafirlər) **şəfaət etməyə qadir olmazlar».** (Məryəm 87).* Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər bir Peyğəmbərin qəbul edilmiş duası vardır. Hər bir peyğəmbər də bu duasını etmişdir. Lakin mən duamı qiyamət günündə ümmətimə şəfaət etmək üçün saxladım. Artıq ümmətimdən Allaha heç bir şeyi şərik qoşmamış olan kimsələr inşəallah bu şəfaətə nail olacaqlar»[1544].

Kimlər üçün şəfaət ediləcəyinə isə, Uca Allah bizlərə ancaq Allahın razı olduğu kimsələr üçün şəfaət ediləcəyini də xəbər vermişdir. ***«Allah onların nə etdiklərini və nə edəcəklərini bilir. Onlar yalnız Allahın razı olduğu kəslərdən ötrü şəfaət edə bilər və onu heybətindən qorxarlar».** (əl-Ənbiya 28). **«O, gün izn verdiyi və söz danışmağa razı olduğu kəslərdən başqa heç kimin şəfaəti fayda verməz».** (Ta ha 109).*

Bütün bu ayələrdən bəlli oldu ki, şəfaət yalnız Allahın söz və əməlindən razı olduğu kimsələrə izn verdikdən sonra və Allahın razı olduğu kimsələrə ediləcəkdir. Bundan qeyri olan şəfaət isə müşriklərin (yəni Allahdan qeyrisinə ibadət edənlərin) bütləri, tanrıları haqqında inandıqları şirk olan şəfaətdir. Çünki onlara görə Allahın izni və rizası olmadan onların bütləri onlara şəfaət edəcəklər. Allah bu cür şəfaət istəyənlər haqqında buyurur: ***«Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilən bütlərə ibadət edir və: «Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir» deyirlər. De ki: «Allaha göylərdə və yerdə** (özünə şərik) **bilmədiyi bir şeyimi xəbər verirsiniz? Allah özünə şərik qoşulan bütlərdən uzaqdır və ucadır».** (Yunus 18). **«Çünki biz sizi** (siz bütləri) **aləmlərin Rəbbi ilə bərabər tutduq. Bizi yalnız günahkarlar azdırdı. İndi artıq nə şəfaət edən kimsələrmiz, nə də bir mehriban dostumuz var! Kaş bir də** (dünyaya) **dönə biləydik, möminlərdən olardıq».** (əş-Şuəra 98-102). «(Ya Peyğəmbər!) **Onları ürəklərin ağıza gələcəyi, udquna belə bilməyəcəkləri yaxın günlə** (qiyamət günü ilə) **qorxut.** (O, gün) **zalimlərin nə bir dostu, nə də bir şəfaətçisi olar».** (əl-Mumin 18). **«Şəfaət edənlərin şəfaəti onlara fayda verməz».** (əl-Muddəssir 48). **«Qorxun elə bir gündən ki, o gün heç kəs heç kəsin işinə yarıya bilməz, heç kəsdən** (gördüyü pis işlər müqabilində) **əvəz** (fidyə) **qəbul edilməz, heç kəsin şəfaəti fayda verməz və** (Allahın əzabından xilas olmaqda) **onlara** (günahkarlara) **heç bir kömək də göstərilməz».** (əl-Bəqərə 123). **«Rəbbinin hüzuruna cəm ediləcəklərindən qorxanları Quranla xəbərdar et. Onların Allahdan başqa heç bir hamisi və həvadarı yoxdur. Bəlkə də onlar pis əməllrdən çəkinsinlər».** (əl-Ənam 51). «(Allaha qoşduqları) **şəriklərindən onlar üçün şəfaət edəcək kimsələr olmayacaq. Onlar öz şəriklərini inkar edəcəklər».** (ər-Rum 13).*

Allahın izni və razılığı olmayan hər hansı bir şəfaət heç kəsdən, hətta şəfaət edən Peyğəmbər də olsa belə ondan qəbul olunmaz. Allah Qurani Kərimdə üç Peyğəmbəri xatırladaraq buyurur ki, onların şəfaəti, şəfaət etdikləri insanlara heç bir fayda verməmişdir. Allah onların şəfaətini qəbul etməmişdir, çünki buna onun izni və razılığı olmamışdır. ***«Nuh Rəbbinə** (dua ilə) **müraciət edib dedi: «Ey Rəbbim! Oğlum** (Kənan) **mənim ailə üzvlərimdəndir. Sənin vədin sözsüz ki, haqdır. Sən hakimlərin***

---

[1544] Buxari, Müslim.

***hakimisən». Allah buyurdu: «O, sənin ailəndən deyildir. Çünki o*** *(küfr etməklə)* ***pis bir iş görmüşdür.*** *(Və ya sənin məndən onu xilas etmək xahişin yaxşı iş deyildir).* ***Elə isə bilmədiyin bir şeyi məndən istəmə. Sənə cahillərdən olmamağı nəsihət edirəm».*** *(Hud 45-46).* ***İbrahim öz atasına: «Mən*** *(öz Rəbbimdən)* ***mütləq sənin bağışlanmağını diləyəcəyəm. Mən heç vəchlə səni Allahdan*** *(Allahın əzabından)* ***qurtara bilmərəm*** *(mənim bacardığım yalnız budur)* ***deməsi istisnadır».*** *(əl-Mumtəhinə 4).* Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – idi ki, müşrik olaraq ölən əmisi üçün Allahdan bağışlanma dilədikdə Allah ona bu əməli qadağan edərək buyurdu: ***«Müşriklərin Cəhənnəmlik olduqları*** *(müsəlmanlara)* ***bəlli olduqdan sonra, onlarla qohum olsalar belə, Peyğəmbərə və iman gətirənlərə onlar üçün bağışlanma diləmək yaraşmaz».*** *(ət-Tövbə 113).*

Belə ki, Allah yaratdığı məxluqlardan şəfaəti yalnız üç şərtlə qəbul edir: **1)** Şəfaət edəndən Allahın razı olması. **2)** Şəfaət olunandan Allahın razı olması. **3)** Allahın şəfaət edənə şəfaət etmək üçün izn verməsi. Bu üç şərtsiz şəfaət edən istər mələk olsa, istər peyğəmbər olsa belə, şəfaəti qəbul olunmayacaqdır.

Quran və Sünnə ilə isbat olunan şəfaətin (qiyamət günü) bir neçə növü vardır.

**1.** Bu ən böyük şəfaət olacaqdır. Bu şəfaət də Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – ə məxsusdur. Allahın ona vəd etmiş olduğu Məqami-Mahmud da budur. ***«Ola bilsin ki, Rəbbin səni*** *(qiyamət günü hamı tərəfindən)* ***bəyənilib tariflənən bir məqama*** *(axirətdəki ən böyük şəfaət məqamına)* ***göndərsin».*** *(əl-İsra 79).* Abdullah b. Amr b. əl-As – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *saəllallahu aleyhi və səlləm* - buyurdu: «Azanı eşitdikdə müəzzinin ardınca onun dediklərini təkrarlayın. Sonra mənə salavat gətirin. Mənə bir dəfə salavat deyənə Allah on dəfə rəhmət deyər. Bundan sonra Allahdan mənim üçün vəsiləni istəyin. Allah onu istədiyi qullarından birinə verəcəkdir və mən ümüd edirəm ki, o mənəm. Mənim üçün Allahdan bunu istəyəcək olana Qiyamət günü mənim onun üçün şəfaət etməyim vacib olar» . Cabir b. Abdullah – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Mənim şəfaətim vacib olar o, adama ki, azanı eşitdikdən sonra deyər: «Ey kamil dəvətin və qılınacaq namazın Rəbbi olan Allahım Muhəmmədə vəsilə dərəcəsini və fəzilətini bəxş et. Onu vəd etdiyin tərifə layiq məqama yüksəlt» .

**2.** Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – Cənnətliklərin cənnətə girməsi üçün şəfaət edəcəkdir. Yəni onlar Cənnətə girməyi haqq qazanmış olmaqla birlikdə, ancaq onun şəfaətindən sonra Cənnətə girmələri üçün onlara izn veriləcəkdir. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, bir gün Rəsulullah - *sallallahu aleyhi və səlləm* – ə ət yeməyi gətirildi və qol tərəfindən bir parça ayrılıb qabağına qoyuldu. Çünki Rəsulullah - *sallallahu aleyhi və səlləm* – ətin bu hissəsini daha çox xoşlayardı. Ondan qabaq dişləri ilə bir dişdəm dişlədikdən sonra buyurdu: «Mən Qiyamət günü bütün insanların seyyidiyəm. Bu nədən belədir bilirsiniz? Dünyada gəlib-getmiş nə qədər insanlar varsa bunların hamısını Allah Qiyamət günündə düz və geniş bir sahədə toplayır. Elə düz və geniş bir sahə ki, carçı səslədikdə səsini hər kəs eşidir və baxan bir kişinin gözü məhşər xalqını bir baxışda görə bilir. Günəş insanlara yaxınlaşdırılır. Artıq insanları qəm-qüssə bürüyür. Dəhşətli və ağır (istiyə) dözməkdə onlarda nə güc, nə də səbr qalır. İnsanların bir qismi digərinə: «Bizim başımıza gələn bu faciəni görmürsünüz!? Bəlkə bizim bu halımıza Allah yanında şəfaət edəcək birisini axtaraq!»

---

[1545] Müslim.

[1546] Buxari – bu haqda «Müsəlmanın qalası» kitabına baxa bilərsiniz. Azan bölümü. Səid əl-Qahtani.

deyəcəklər. İnsanların bir qismi: «Adəm – *əlehissəlam* – ın yanına gedək?» deyəcəklər. İnsanlar onun yanına gəlib: «Ey Adəm! Sən insanların atasısan. Allah səni əli ilə yaratdı və öz ruhundan sənə həyat verdi. Sonra mələklərə əmr etdi, onlar da sənə səcdə etdilər. Bizim üçün Rəbbimizdən şəfaət dilə. Ey atamız! Sən bizim bu vəziyyətimizi görmürsən? Başımıza gələn bu müsibəti görmürsən?» deyəcəklər. Adəm – *əlehissəlam* – da: «Şübhəsiz ki, Rəbbim bu gün bərk qəzəblənmişdir. O, dərəcədə ki, nə bundan qabaq belə bir qəzəb etmişdir, nə də bundan sonra belə bir qəzəb edəcəkdir. Allah bu ağacdan yeməyi mənə qadağan etmişdir. Mən isə ona asi oldum (artıq sizə şəfaət edə bilmərəm, indi mən özümü düşünürəm). Vay nəfsim, nəfsim! Siz məndən başqa bir şəfaətçiyə gedin. Nuh – *əlehissəlam* – ın yanına» deyəcəkdir. İnsanlar Nuhun yanına gələrək: «Ey Nuh! Sən Allahın insanlara göndərdiyi ilk rəsulsan. Allah səni (Quranda) ***«Çox şükr edən qul».*** *(əl-İsra 3)* deyə vəsf edir. Bizim üçün Rəbbimizdən şəfaət dilə. Sən bizim bu vəziyyətimizi görmürsən? Başımıza gələn bu müsibəti görmürsən?» deyəcəklər. Nuh: «Şübhəsiz ki, Rəbbim bu gün bərk qəzəblənmişdir. O, dərəcədə ki, nə bundan qabaq belə bir qəzəb etmişdir, nə də bundan sonra belə bir qəzəb edəcəkdir. Heç şübhəsiz ki, mənə (dünya həyatımda Rəbbimə) bir dəfə dua etmək fürsəti verilmişdir. Mən də onu öz qövmümün əleyhinə etdim (artıq sizə şəfaət edə bilmərəm, indi mən özümü düşünürəm). Vay nəfsim, nəfsim! Siz məndən başqa bir şəfaətçiyə gedin. İbrahim – *əlehissəllam* – ın yanına» deyəcəkdir. İnsanlar İbrahim – *əlehissəlam* – ın yanına gələrək: «Ey İbrahim! Sən yer üzündə Allahın Peyğəmbəri və Allahın dostusan. Bizim üçün Rəbbimizdən şəfaət dilə. Sən bizim bu vəziyyətimizi görmürsən? Başımıza gələn bu müsibəti görmürsən?» deyəcəklər. İbrahim: «Şübhəsiz ki, Rəbbim bu gün bərk qəzəblənmişdir. O, dərəcədə ki, nə bundan qabaq belə bir qəzəb etmişdir, nə də bundan sonra belə bir qəzəb edəcəkdir. (O ki, qaldı mənə) Mən üç dəfə yalan danışmışam (artıq sizə şəfaət edə bilmərəm, indi mən özümü düşünürəm). Vay nəfsim, nəfsim! Siz məndən başqa bir şəfaətçiyə gedin. Musa – *əlehissəlam* – ın yanına» deyəcəkdir. İnsanlar Musa – *əlehissəlam* – ın yanına gələrək: «Ey Musa! Sən Allahın peyğəmbərisən. Allah sənə risalətini verməklə və səninlə vasitəçisiz danışmaqla insanlar üzərində fəzilətli etdi. Bizim üçün Rəbbimizdən şəfaət dilə. Sən bizim bu vəziyyətimizi görmürsən? Başımıza gələn bu müsibəti görmürsən?» deyəcəklər. Musa: «Şübhəsiz ki, Rəbbim bu gün bərk qəzəblənmişdir. O, dərəcədə ki, nə bundan qabaq belə bir qəzəb etmişdir, nə də bundan sonra belə bir qəzəb edəcəkdir. (O ki, qaldı mənə) Mən isə öldürülməsinə heç bir qərar olmayan insanı öldürmüşəm (artıq sizə şəfaət edə bilmərəm, indi mən özümü düşünürəm). Vay nəfsim, nəfsim! Siz məndən başqa bir şəfaətçiyə gedin. İsa– *əlehissəlam* – ın yanına» deyəcəkdir. İnsanlar İsa– *əlehissəlam* – ın yanına gələrək: «Ey İsa! Sən Allahın Rəsulu, Allahın Məryəmə dediyi söz və ondan gəlmə bir ruhsan. Sən beşikdə ikən insanlarla danışdın. Bizim üçün Rəbbimizdən şəfaət dilə. Sən bizim bu vəziyyətimizi görmürsən? Başımıza gələn bu müsibəti görmürsən?» deyəcəklər. İsa: «Şübhəsiz ki, Rəbbim bu gün bərk

[1547] Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «İbrahim – *əlehissəlam* – bu üç hal müstəsna əsla yalan danışmamışdır. Bu yalanlardan iksi Allahın zatı və rizası üçündür. Birinci: «Bütpərəstlərə mən xəstəyəm deməsi, ikincisi isə bütün bütləri sındıraraq öz qövmünə: «Bəlkə bu işi bütlərin bu böyüyü edib?!» deməsidir. Üçüncüsü isə İbrahimin yanında Sara olduğu halda zalım hökmdarın ərazisindən keçərkən yoldaşına əgər səndən kim olduğunu soruşarsa de ki, sən mənim bacımsan. Şübhəsiz ki, «Sən mənim İslamda bacımsan». Daha geniş məlumat üçün bax: Buxari 1412,1543, Müslim.

[1548] Fironun adamlarından bir Misirli Musa – *əlehissəlam* – qövmündən biri ilə döyüşürdü. Musanın qövmündən olan Musadan kömək istədikdə, Musa da kömək edərək düşmənin sinəsinə yumruqla vurur. Bu yumruq da onu öldürür. (əl-Qəsəs 18)-ci ayəsinə bax.

qəzəblənmişdir. O, dərəcədə ki, nə bundan qabaq belə bir qəzəb etmişdir, nə də bundan sonra belə bir qəzəb edəcəkdir. Özü haqqında heç bir günahı zikr etməyərək (artıq sizə şəfaət edə bilmərəm, indi mən özümü düşünürəm) (Başqa rəvayətdə: Mən Allahdan başqa tanrı edildim ). Vay nəfsim, nəfsim! Siz məndən başqa bir şəfaətçiyə gedin. Muhəmməd - *sallallahu aleyhi və səlləm* – in yanına» deyəcəkdir. Nəhayət onlar mənim yanıma gələrək: «Ey Muhəmməd! Sən Allahın Rəsulu və Peyğəmbərlərin sonuncususan. Allah sənin keçmiş və gələcək günahlarını bağışlamışdır. Rəbbimizin hüzurunda bizə şəfaət et. Sən bizim bu vəziyyətimizi görmürsən? Başımıza gələn bu müsibəti də görmürsən?» deyəcəklər. Bundan sonra mən həmən Ərşin altına gələrək Rəbbimin qarşısında səcdəyə qapanıram. Sonra səcdə də, Allaha edilən həmd-sənadan sonra (Allah) məndən əvvəl heç bir Peyğəmbərə deyilməyən təriflər deyər: «Ya Muhəmməd! Başını qaldır, söylə! Sözün dinlənilir! İstə, sənə verilir! Şəfaət et, şəfaətin qəbul edilir!» buyurur. Mən səcdədən başımı qaldırıb: «Ya Rəbbim! Ümmətim, ümmətim!» deyə şəfaət edərəm. Bundan sonra: «Ya Muhəmməd! Ümmətindən sorğu-sual olunmayanları Cənnətin qapılarından olan sağ qapıdan içəri sal. Lakin onlar digər qapılardan da içəri girə bilərlər». Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Nəfsim əlində olan Allaha and olsun ki, Cənnətin qapı qanadlarından iki qanadın arası Məkkə ilə Həcər və ya Məkkə ilə Busra arası qədər genişdir». Başqa bir rəvayətdə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah (Qiyamət günü) insanları toplayır, möminlər ayağa qalxırlar. Nəhayət Cənnət onlara yaxınlaşdırılır». İnsanlar Adəm – *əlehissəlam* – gələrək: «Ey atamız! Cənnəti bizə açdır» deyəcəklər. Adəm: «Sizləri Cənnətdən ancaq atanız Adəmin xətası çıxartdı. Mən bunun sahibi deyiləm. Sizlər mənim oğlum İbrahim – *əlehissəlam* – ın yanına gedin» deyəcəkdir. İbrahim: «Mən bunun sahibi deyiləm. Mən ancaq pərdə arxasından xəlil (dost) olmuşdum. Sizlər Allahın Kəlimətullahı olan Musa – *əlehissəlam* – ın yanına gedin» deyəcəkdir. Camaat Musa – *əlehissəlam* – ın yanına gəlirlər. Musa: «Mən buna sahib deyiləm. Sizlər Allahdan gəlmə söz və ondan gəlmə bir ruh olan İsa – *əlehissəlam* – ın yanına gedin» deyəcəkdir. İsa: «Mən buna sahib deyiləm!» deyəcək və insanları Muhəmməd - *sallallahu aleyhi və səlləm* – in üstünə göndərəcəkdir» .

**3.** Cəhənnəmdə bəzi müşriklərin cəzasının yüngülləşdirilməsi üçün ediləcək şəfaət. Səid b. Musəyyibin atası deyir ki, Əbu Talib ölüm anında ikən Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – onun yanına gəldi. Onun yanında Əbu Cəhl ilə Abdullah b. Əbu Umeyyə b. Muğirə də var idi. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ey əmi! ***Lə İləhə İlləllah*** **–** kəlməsini de ki, bununla Allah yanında sənin lehinə şəhadət edim». Əbu Cəhl və Abdullah b. Əbu Umeyyə b. Muğirə də: «Ya Əbu Talib! AbdulMuttalibin millətini tərk mi edirsən?» dedilər. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – sözünü əmisinə deməkdə davam edirdi. Onlar da öz sözlərini deməkdə davam edirdilər. Nəhayət Əbu Talibin onlara söylədiyi son söz: «AbulMuttalibin milləti üzərindəyəm!» oldu və: «***Lə İləhə İlləllah***» deməkdən çəkindi. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yaxşı bil ki, Allaha and olsun ki, qadağan olunanadək sənin üçün Allahdan bağışlanma diləyəcəyəm». Bundan sonra Allah ayə nazil etdi: ***«Müşriklərin Cəhənnəmlik olduqları*** *(müsəlmanlara)* ***bəlli olduqdan sonra, onlarla qohum olsalar belə, Peyğəmbərə və iman gətirənlərə onlar üçün bağışlanma diləmək yaraşmaz».*** *(ət-Tövbə 113). «(Ya Muhəmməd!)* ***Şübhəsiz ki, sən istədiyini doğru yola***

---

1549 Əhməd 2/281,282.
1550 Müslim.

***yönəldə bilməzsən. Amma Allah dilədiyini doğru yola salar. Doğru yolda olacaq kəsləri** (öz əzəli elmi ilə) **daha yaxşı o bilir».** (əl-Qəsəs 56).* Başqa rəvayətdə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ey əmi! ***Lə İləhə İlləllah –*** kəlməsini de ki, bununla Allah yanında sənin lehinə şəhadət edim». Əbu Talib: «Qureyşin məni ayıblaması və haqqımda: «Əbu Talib bunu ancaq qorxudan dedi!» demələri olmasaydı, onu deyib səni məmnun edərdim»[1551]. Abbas b. AbdulMuttalib – *radıyallahu anhu* – deyir ki: «Ya Rəsulallah! Şübhə yox ki, Əbu Talib daima səni düşmənlərdən qoruyur və sənə kömək edirdi. Bunlar ona fayda verəcəkmi?» Peyğəmbər: «Bəli, mən onu böyük Cəhənnəm atəşi içində olduğunu gördüm və sonra onu oradan topuğuna qədər olan bir atəş çuxuruna çıxardım. Oradan belə beyni qaynayır»[1552].

**4.** Bir qurup insanların sorğu-sualsız olaraq Cənnətə girmələri üçün ediləcək şəfaət. Hüseyn b. AbdurRahman deyir ki: «Mən Səid b. Cubeyrin yanında idim. Dünən sizin hansınız düşən ulduz gördünüz?» dedim. O: «Mən gördüm» dedi. Sonra əlavə etdi ki: «O, vaxt mən namazda deyildim. Məni əqrəb sancmışdı». O: «Bəs sən nə etdin?» deyə soruşdu. Mən: «Ruqiyyə (dua) etdim» dedim. O: «Səni buna sövq edən nə idi?» dedi. Mən: «Şabinin rəvayət etdiyi hədisdir» dedim. O: «Şabinin sizə rəvayət etdiyi nədir» dedi. Mən belə rəvayət etdim: «O, bizə Burəydə b. Huseyn əl-Əsləmdən rəvayət edib» dedi: O: «Göz dəyənə yaxud ilan çalana ruqiyyə (dua) ilə əlac etmək olar» demişdir. Bunun üzərinə o, dedi: «Eşitdiyinə (eşitdiyi kimi) əməl edən insan nə gözəl insandır». Lakin İbn Abbas – *radıyallahu anhu* – bizə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – dən belə bir hədis nəql etmişdi: «Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurmuşdu: «Mənə bütün ümmətlər göstərildi. Peyğəmbər gördüm ki, ətrafında çox kiçik bir cəmaat var idi. Peyğəmbər gördüm ki, ətrafında bir və ya iki nəfər var idi. Bir Peyğəmbər də gördüm ki, ətrafında bir nəfər də belə yox idi» deyərkən, mənə üzaqdan bir qaraltı göstərildi. Mən onları ümmətimdən zənn etdim». Mənə: «Bu Musa – *əlehissəlam* – ın qövmüdür» dedilər. Sən üfüqə doğru bax! Mən baxdıqda bir də nə gördüm? Böyük bir qaraltı. Mənə təkrar: «Digər üfüqə doğru bax!» deyildi. Yenə də böyük bir qaraltı gördüm. Mənə: «Bu sənin ümmətindir. Bunlar ilə bərabər yetmiş min nəfər hesabsız və əzabsız olaraq Cənnətə girəcəkdir» deyildi. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – bu xütbəsindən sonra qalxıb evinə girdi. Bunun ardından insanlar, hesabsız və əzabsız olaraq Cənnətə girəcək olan bu kimsələr haqqında müzakirəyə başladılar. Bəzisi: «Şübhəsiz ki, bunlar Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in dost-yoldaşlarıdır». Bəziləri də: «Bəlkə onlar İslamda doğulan və Allaha şərik qoşmayanlardır» dedilər. Bunlardan başqa bəzi fikirlər irəli sürüldü. Bu vaxt Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – onların yanına gəldi və: «Haqqında müzakirə etdiyiniz şey nədir?» deyə buyurdu. Ona məsələni başa saldıqdan sonra Peyğəmbər: «Cənnətə haqq-hesabsız girən möminlər, ovsun oxumazlar və tələb etdirməzlər. Təşəəüm, Tətəyyür etməzlər və hər şeydə öz Rəblərinə təvəkkül edərlər» buyurdu. Bu vaxt Ukkaşa b. Mihsan ayağa qalxıb: «Mən də onlardan etməsi üçün Allaha dua et» dedim. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sən onlardansan». Onun ardınca başqa birisi qalxıb dedi: «Məni də onlardan etməsi üçün Allah dua et» dedi. Peyğəmbər: «Bu işdə Ukkaşa səndən qabağı düşdü» buyurdu. Başqa bir rəvayətdə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurur: «Ümmətimdən bir zümrə Cənnətə

[1551] Müslim.
[1552] Müslim.

girər ki, onlar yetmiş mindir. Onların üzləri ayın bədr gecəsindəki parlaması kimidir. Onlar qızğın dəmirlə bədənlərini dağlamayanlardır» .

**5.** Bir qurup Cəhənnəmə düşmüş Muvahhidlərin (Tövhid əhlinin) cəhənnəmdən çıxarılması üçün ediləcək şəfaət. Məbəd b. Xəlil əl-Ənəzi dedi: «Sabit şəfaət hədisini eşitməkdən ötrü Ənəs b. Məlikin yanına getdik. Duha namazını qılan vaxtı onun yanına çatdıq. Sabit bizim üçün izn istədi. Yanına girdik». Sabit ona: «Ey Əbu Həmzə! Bəsrə əhalisindən olan bu qardaşların səndən şəfaət hədisini eşitmək üçün gəliblər» dedi. Ənəs – *radıyallahu anhu* – rəvayət etdi ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü insanlar çaşqın düşəcəklər. Nəhayət Adəmə gəlib: «Zürriyətinə şəfaət et!» deyəcəklər. Adəm: «Mən ona layiq deyiləm, lakin sizlər İbrahim – *əlehissəlam* – ın yanına gedin. Çünki o, Xəlilullahdır» deyəcəkdir. İnsanlar İbrahim – *əlehissəlam* – ın yanına gəlirlər. O, da: «Mən buna layiq deyiləm, lakin siz Musa – *əlehissəlam* – ın yanına gedin. Çünki o, Kəlimullahdır» deyəcəkdir. İnsanlar Musa – *əlehissəlam* – ın yanına gəlirlər. O, da: «Mən buna layiq deyiləm, lakin siz İsa – *əlehissəlam* – ın yanına gedin. Çünki o, Allahdan gəlmə ruh və Ondan olan sözdür» deyəcəkdir. İnsanlar İsa – *əlehissəlam* – ın yanına gəlirlər. O, da: «Mən buna layiq deyiləm, lakin siz Muhəmməd - *sallallahu aleyhi və səlləm* – in yanına gedin» deyəcəkdir. Nəhayət mənim yanıma gəlirlər. O, da: «Mən bunun üçün yaradıldım!» deyir və Allahın hüzuruna izn istəmək üçün gedər. «Mənə izn verilir, hüzurunda dikilərək və Allaha həmd-səna etdikdən sonra səcdə edərək yerə qapanıram». Mənə: «Ya Muhəmməd! Başını qaldır, söylə! Sözün dinlənilir! İstə, sənə verilir! Şəfaət et, şəfaətin qəbul edilir!». Bundan sonra mən: «Ya Rəbbim! Ümmətim, ümmətim!» deyə şəfaət diləyirəm. Mənə: «Get! Qəlbində bir buğda və ya arpa dənəsi qədər iman olan hər kim varsa onu oradan çıxart!» deyilir. Mən dərhal gedib bunu yerinə yetirdikdən sonra yenə Rəbbimə dönüb onu həmd-səna etdikdən sonra səcdə edərək yerə qapanıram». Mənə: «Ya Muhəmməd! Başını qaldır, söylə! Sözün dinlənilir! İstə, sənə verilir! Şəfaət et, şəfaətin qəbul edilir!». Bundan sonra mən: «Ya Rəbbim! Ümmətim, ümmətim!» deyə şəfaət diləyirəm. Mənə: «Get! Hər kimin qəlbində bir xardal toxumu qədər iman varsa onu oradan çıxart!» deyilir. Mən dərhal gedib bunu yerinə yetirdikdən sonra yenə Rəbbimə dönüb onu həmd-səna etdikdən sonra səcdə edərək yerə qapanıram». Mənə: «Ya Muhəmməd! Başını qaldır! Söylə, sözün dinlənilir! İstə, sənə verilir! Şəfaət et, şəfaətin qəbul edilir!». Bundan sonra mən: «Ya Rəbbim! Ümmətim, ümmətim!» deyə şəfaət diləyirəm. Mənə: «Get! Hər kimin qəlbində bir xardal toxumu ağırlığından daha az, daha az, daha az iman varsa onu da atəşdən çıxart!» deyilir. Mən də dərhal gedib bunu yerinə yetirdim.

Bu Ənəs – *radıyallahu anhu* – nun bizə xəbər vermiş olduğu: «Ənəs hədisidir». Biz onun yanından çıxdıq. Nəhayət səhranın yüksək bir yerinə yetişdiyimiz zaman Həsənul-Bəsrinin yanına çatsaq da, ona salam versək də, o, Əbu Xəlifənin evində gizlənmiş bir halda idi. Onun yanına girdik, salam verdik və: «Ya Əbu Səid! Biz qardaşın Əbu Həmzənin yanından gəlirdik. Şəfaət haqqında danışdığı hədisi heç eşitməmişdik». O: «Davam edin, hədisi söyləyin» dedi. Biz də ona hədisi danışdıq. O, yenə: «Davam edin, söyləyin» dedi. Biz: «Ənəs bundan başqasını danışmadı» dedik. O, dedi: «O, bizə bunu iyirmi il bundan qabaq danışmışdır. O, vaxt hafizəsi və qüvvəsi çox gözəl idi. İndi isə bir qism şeyləri unutmuşdur. Şeyx bunu unutdumu, yoxsa sizlərə bunu danışmaq istəmədimi – bilmirəm?!». Biz də: «Sən bizə danış» dedik. O, güldü

[1553] Buxari, Müslim.

və: ***«İnsan tələsən-hövsələsiz yaradılmışdır».*** *(əl-Ənbiya 37)* (ayəsini oxudu). Sonra Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – dördüncü dəfə yenə Rəbbinin yanına qayıdacaq. Ona həmd-səna etdikdən sonra səcdə edərək yerə qapanacaq!». Mənə: «Ya Muhəmməd! Başını qaldır! Söylə, sözün dinlənilir! İstə, sənə verilir! Şəfaət et, şəfaətin qəbul edilir!». Bundan sonra mən: «Ya Rəbbim! Mənə izn ver: «Lə İləhə İlləllah» deyən kimsələr haqqında şəfaət edim. Allah – *subhənəhu və təalə* – ona: «Bu sənin üçün deyil (və ya bu sənə aid deyil) deyə buyurdu. Lakin İzzətimə, Kibriyəyə, Əzəmətimə və Cibriyəyə and olsun ki: «Lə İləhə İlləllah» deyən kimsəni Cəhənnəmdən çıxardacağam! (Başqa rəvayətdə: İzzətimə, Cəlalıma, Kibriyəyə və Əzəmətimə and olsun ki: «Lə İləhə İlləllah» deyən kimsəni Cəhənnəmdən çıxardacağam!)»[1554]. Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Dörd kimsə Cəhənnəmdən çıxarılıb Allahın hüzuruna götürüləcəkdir. Sonra təkrar Cəhənnəmə göndərilmələri əmr edildikdə onlardan biri: «Ya Rəbbim! Məni Cəhənnəmdən çıxardığında təkrar Chənnəmə geri göndərəcəyini heç ummamışdım» deyər. Allah onu Cəhənnəmdən qurtarar»[1555].

**6.** Cəhənnəmə girmələri əmr olunmuş bir qurup insanların Cəhənnəmə girməmələri üçün ediləcək şəfaət. Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – rəvayət etdi ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurur: «….Nəhayət möminlər atəşdən qurtulduqları zaman, nəfsim əlində olana and içirəm ki, sizdən heç kimsənin haqqı təmamilə bərqərar etmək xüsusunda Allaha yalvarıb yaxarması, qiyamət günündə möminlərdən atəşdə olan qardaşları üçün Allaha yalvarmaları qədər şiddətli olmaz». Onlar: «Ey Rəbbimiz! Bu (Cəhənnəmdə) qalanlar bizimlə bərabər oruc tutar və həcc edərdilər!» deyirlər. Onlara: «Tanıdığınız kimsələri oradan çıxarın! Onların üzləri Cəhənnəmə haram edildi!» deyilir. Atəş onlardan kimisinin topuqlarına qədər, kimisinin diz qapaqlarına qədər yandırır. Onlardan bir çoxunu oradan çıxarırlar. Sonra: «Ey Rəbbimiz! Cəhənnəmdə əmr etdiklərindən heç kimsə qalmadı!» deyirlər. Allah buyurur: «Geri dönün! Qəlbində bir dinar ağırlığında iman və yəqin olan hər kimi tanıyıyırsınızsa onu da oradan çıxarın!». Onlar yenə də bir çoxlarını oradan çıxarırlar. Sonra yenə: «Ey Rəbbimiz! Cəhənnəm içərsində əmr etdiklərindən heç kimsəni buraxmadıq!» deyirlər. Allah buyurur: «Geri dönün! Qəlbində yarım dinar ağırlığında xeyr olan hər kimi tanıyırsınızsa onu da oradan çıxarın!». Onlardan bir çoxunu oradan çıxarırlar. Sonra təkrar: «Ey Rəbbimiz! Cəhənnəmdə əmr etdiklərindən heç kimsəni buraxmadıq!» deyirlər. Allah buyurur: «Geri dönün! Qəlbində zərrə ağırlığında xeyr olan hər kimi tapırsınızsa onu oradan çıxarın!». Yenə bir çox insanları oradan çıxarırlar. Sonra təkrar: «Ey Rəbbimiz! Orada xeyr sahibi olan heç bir kimsəni buraxmadıq!» deyirlər. Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – deyir ki, əgər bu hədisə inanmırsınızsa bu ayəni oxuyun: ***«Həqiqətən Allah zərrə qədər zülm etməz. Əgər yaxşı bir əməl baş verərsə onu iki qat artırar və öz tərəfindən də böyük mükafat verər».*** *(ən-Nisa 40).*

Başqa rəvayətdə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Nəhayət Allahın rəhmətindən olaraq, qulları arasında Cəhənnəm əhlindən dilədiklərini Cəhənnəmdən çıxartmağı əmr edərək mələklərə: «***Lə İləhə İlləllah***» – deyənlərdən, Allahın mərhəmət buyurduğu kimsələrdən, Allaha bir şeyi şərik (ortaq) qoşmamış olanları Cəhənnəmdən çıxarsınlar!» deyə əmr edir. Mələklər: «Onları Cəhənnəmdə

---

Buxari 7510, Müslim 326.

[1555] Müslim «İman» 321.

səcdə yerlərindən tanıyırlar. Atəş Adəm oğullarının səcdə yeri müstəsna, hər yerini yeyir. Allah səcdə yerinə toxunmağı atəşə haram etmişdir». Bundan sonra Allah buyurur: «Mələklər şəfaət etdilər, Peyğəmbərlər şəfaət etdilər, möminlər şəfaət etdilər. Şəfaət etməyən bir ***Ərhamur-Rahimin*** qaldı. Bundan sonra atəşdən bir camaatı toplayır və dünyada ikən heç bir xeyr işləməyib cəhənnəmdə kömürə dönmüş bir çox kimsələri çıxarır. Cənnətin yolları üzərində olan «***Həyat Çayı***» adı verilən bir çaya salınırlar. Onlar selin gətirdiyi yabanı reyhan toxumları kimi çıxırlar. Görmürsünüz ki, yabanı reyhan bəzən bir daş və ya bir ağac dibində (kölgədə bitdiyi kimi) necə olur. Günəşə doğru olanı sarı, yaşıl olur. Kölgədə olan hissəsi isə açıq olur. (Başqa rəvayətdə «Ey Cənnət əhalisi! Bunların üzərinə bol su, Cənnət sularından tökün!» deyiləcəkdir). Cənnət əhalisi onları tanıyır. Heç bir yaxşılıq etməmiş, xeyr əməllər işləməmiş halda Allahın Cənnətə saldığı kəslər bunlardır. Allah buyurur: «Cənnətə girin! Gözünüzün görə bildiyi hər nə varsa sizindir». Onlar: «Ey Rəbbimiz! Sən aləmlərdə heç kəsə vermədiyin yaxşılığı bizə verdin!» Onlara: «Sizə bundan gözəl bir şey vardır!» Onlar: «Ey Rəbbimiz! Bundan da gözəl?!» Allah buyurur: «Mənim rizam! Artıq bundan sonra sizə əbədiyyən qəzəb etməyəcəyəm» .

**7.** Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – Cənnətə girən bir qrup insanların əməllərinin mükafatı olaraq Cənnətdə dərəcələrinin artırılması üçün ediləcək şəfaət. Ənəs b. Məlik – *radıyallahu anhu* – rəvayət etdi ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şəfaətim ümmətim arasında böyük günah etmiş kimsələrə olacaqdır» . Osman – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Qiyamət günü üç sinif insan şəfaət edəcəkdir: «Peyğəmbərlər, alimlər, şəhidlər və möminlər» .

Bütün bu şəfaətlərdən başqa Qiyamət günü qulun tutduğu oruc, oxuduğu Quran da şəfaət edəcəkdir. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Oruc və Quran Qiyamət günü qula şəfaət edəcəkdir» . Əbu Umamə – *radıyallahu anhu* – rəvayət etdi ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Quranı öyrənin, çünki o, qiyamət günü əhli üçün şəfaətçi olacaqdır» . ən-Nəvvas b. Səman – *radıyallahu anhu* – rəvayət etdi ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü Quran və ona əməl edənlər gətiriləcək. İrəlidə əl-Bəqərə və Ali-İmran surələri gedəcəklər. Oxuyub əməl edənlərə şəfaət edəcəklər» . Əli – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim Quran oxuyar, onu əzbərləyər, halal saydığını qəbul edər, haram etfdiyi şeyi də haram edərsə Allah o, kimsəni Cənnətə salar. Ayrıca Cəhənnəmə girmələri əmr edilmiş ailəsindən on kimsəyə şəfaətçi olar» .

Qiyamət günü baş verəcək hadisələrdən sonra Cənnətliklər Cənnətdə, Cəhənnəmliklər də Cəhənnəmdə qərar tutduqdan sonra: Əbu Səid – *radıyallahu anhu* – rəvayət etdi ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü (Cənnət əhli Cənnətə, Cəhənnəmliklər də Cəhənnəmə ayrıldıqdan sonra) ölüm, qara bir qoyun surətində gətirilir. Cənnət ilə Cəhənnəm arasında dayandırılır və: «Ey Cənnət

---

[1556] Müslim.
[1557] İmam Əhməd «Musnəd» 3/213.
[1558] Heysəmi «Məcmuu Zəvaid» 10/381.
[1559] əl-Albani «Səhih Hədislər Silsiləsi» 3882.
[1560] Müslim.
[1561] Müslim.
[1562] Tirmizi 2907.

əhli! Sizlər bunu tanıyırsınızmı?» deyilir. Cənətliklər dərhal boyunlarını uzadıb başlarını ona doğru qaldırırlar və ona (qoyuna) baxırlar; «Bəli, tanıyırıq! Bu ölümdür» deyirlər. Sonra: «Ey Cəhənnəm əhli! Sizlər bunu tanıyırsınız?» deyilir. Onlar da başlarını qaldıraraq baxırlar və: «Bəli, tanıyırıq! Bu ölümdür» deyirlər. Bundan sonra qoyunun kəsilməsini əmr edirlər və dərhal qoyun kəsilir. Sonra: «Ey Cənnət əhli! Cənnətdə əbədi yaşayacaqsınız, artıq sizə ölüm yoxdur! və ey Cəhənnəm əhli! Sizlər də Cəhənnəmdə əbədisiniz, artıq ölüm yoxdur!» deyilir. Bundan sonra Peyğəmbər - *sallallahu aleyhi və səlləm –* bu ayəni oxudu: *(Ya Muhəmməd!)* ***Qəflətdə olanları və iman gətirməyənləri işin bitmiş olacağı*** *(haqq-hesab çəkilib möminlərin cənnətə, kafirlərin isə Cəhənnəmə girəcəyi)* ***peşmançılıq günü*** *(insanın pis əməllərinə görə peşman olacağı, lakin bu peşmançılığın heç bir fayda verməyəcəyi qiyamət günü)* ***ilə qorxut!*** *(O, gün bütün)* ***yer üzünə və onun üzərində olan hər şeyə yalnız biz varis olacağıq. Onlar bizim hüzurumuza qaytarılacaqlar».*** *(Məryəm 39-40)*

## QƏZA VƏ QƏDƏRƏ İMAN

Əhli Sünnə Vəl Cəmaat hər xeyr və şərrin Allahın Qəza və Qədəri ilə meydana gəldiyinə: ***«Şübhəsiz ki, biz hər şeyi müəyyən ölçüdə*** *(lazım olduğu qədər)* ***ilə yaratdıq».*** *(əl-Qəmər 49).* Allahın dilədiyi hər bir şeyi etdiyinə kəsin olaraq inanırlar. Hər şey onun iradəsi ilədir. Heç bir şey onun istəməsindən kənara çıxa bilməz. O, olmuş və olacaq hər şeyi olmazdan əvvəl, əzəldən bəri bilir. Onun elmi geniş və cüzi olan hər bir şeyi əhatə edir. ***«(Rəbbin) onların keçmişini də, gələcəyini də bilir. Onların elmi isə onu əhatə edib qavraya bilməz».*** *(Ta ha 110).* ***«Göylərdə və yerdə zərrə qədər bir şey ondan gizli qalmaz. Bundan kiçik, yaxud böyük elə bir şey yoxdur ki, açıq-aydın kitabda olmasın».*** *(Səba 3).*

Allahın dilədiyinin olduğuna, diləmədiyinin olmadığına, göylərdə və yerdə nə varsa mütləq onun diləməsi ilə olduğuna, mülkündə istəmədiyi heç bir şeyin olmadığına, var olan və olmayan nə qədər məxluq varsa mütləq Allah tərəfindən yaradılmış olduğuna, Ondan başqa bir yaradıcı, Ondan başqa bir Rəbb olmadığına iman etməkdir. ***«Allah istəməsə siz*** *(bunu)* ***istəyə bilməzsiniz. Həqiqətən Allah*** *(hər şeyi)* ***biləndir, hikmət sahibidir».*** *(Dəhr 30).* ***«Əgər biz*** *(istədikləri kimi)* ***mələkləri onlara göndərsək, ölülər onlarla danışsa və hər şeyi dəstə-dəstə başlarına toplasaq, əgər Allah istəməsə, yenə də iman gətirməzlər. Lakin onların əksəriyyəti*** *(bunu)* ***bilməz».*** *(əl-Ənam 111).* ***«Allah istədiyini azdırar, istədiyini isə düz yola yönəldər».*** *(əl-Ənam 39).* ***«Əgər Rəbbin istəsəydi yer üzündə olanların hamısı iman gətirərdi».*** *(Yunus 99).*

Şair deyir: «Sənin dilədiyin olur, mən diləməsəm də belə,
Və əgər sən diləməzsən, mənim diləyim olmaz».

Uca Allah olmuşu, olacağı, olmamış olanı, əgər olacaq olsa necə olacağını bilir. ***«Gətirilib od üstündə saxlandıqları zaman sən onların: «Kaş ki, biz qaytarılıb Rəbbimizin ayələrini yalan hesab etməyəydik və möminlərdən olaydıq!» dediklərini görəydin! Xeyr əvvəlcə*** *(ürəklərində)* ***gizlətdikləri*** *(küfr, nifaq və çirkin əməllər)* ***onların qabağına çıxdı. Əgər geri qaytarılsaydılar, yenə də onlar qadağan olunduqları şeyə*** *(küfrə və günaha)* ***əl qatardılar. Onlar şübhəsiz ki, yalançıdırlar.*** *(Əgər onlar dünyaya qaytarılsaydılar)* ***yenə də: «Həyat yalnız bu dünyadakı həyatımızdan ibarətdir. Bizlər bir daha dirilən deyilik!» deyərdilər».*** *(əl-Ənam 27-*

---

[1563] Müslim.

*29).* Allah hər nə qədər onların geri qaytarılmayacaqlarını bilirsə, əgər geri qaytarılacaq olurlarsa yenə də çirkin əməllərə dönəcəklərini xəbər verməkdədir. ***«Əgər Allah*** *(əzəldən)* ***onlarda bir xeyr*** *(olacağını)* ***bilsəydi*** *(haqq sözü)* ***onlara eşitdirərdi. Onlar eşitsəydilər belə, yenə də*** *(haqdan inadla)* ***üz çevirərək dönüb gedərdilər».*** *(əl-Ənfal 23).* Bu da: «İşlər üçün əzəldən bir qədər yoxdur, hər şey baş verəndən sonra yazılır, Allah bir şeyi yaratmamışdan və var etmədən öncə onu bilməz deyən Qədəriyyənin görüşlərini rədd etməkdədir.

*«(Ya Muhəmməd!)* ***Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən. Amma Allah dilədiyini doğru yola salar. Doğru yolda olan kəsləri*** *(öz əzəli elmi ilə)* ***daha yaxşı O bilir!»*** *(əl-Qəsəs 56).* Söylədiyimiz kimi əgər hidayət yolu açıqlamaqdan ibarət olsaydı Peyğəmbərlər hidayətə yönəldərdilər. Çünki onlar sevənə də, sevməyənə də yolu açıq-aşkar göstərmişlər. ***«Allah istədiyi kimsəni*** *(haqq yoldan)* ***belə azdırar və istədiyini də doğru yola salır».*** *(əl-Muddəssir 31).* Uca Allah kimi imana yönəldir və hidayət verirsə bu onun lütfüylədir. Bundan ötrü həmd yalnız onadır. Kimi də sapdırırsa bu da onun ədalətilədir. Bundan ötrü də həmd yalnız onundur.

Xeyir və şərrin hər iksi də qədərdəndir. Hər şey bir qədər, ölçü, zaman ilə yaradılmışdır. Hər yaradılan şeyin bir qədəri vardır. ***«O, Allah ki, göylərin və yerin hökmü onundur. O*** *(özünə)* ***heç bir övlad götürməmişdir. Mülkündə heç bir şəriki yoxdur. O, hər şeyi yaratmış və onu*** *(onun üçün nə olacağını)* ***əvvəlcədən müəyyən etmişdir».*** *(əl-Furqan 2).* ***«Allahın izni olmadıqca*** *(heç kəsə)* ***heç bir müsibət üz verməz. Kim Allaha iman gətirsə, Allah onun qəlbini haqqa doğru yönəldər və o, dünyada baş verən hər şeyin Allahın əzəli hökmü və izni ilə olduğunu bilər. Allah hər şeyi biləndir».*** *(ət-Təğabun 11).*

***Qədər –*** İstilahi mənasi – bir şeyin həddini, sayını bilmək, qərar, hökm deməkdir. ***Qadaru – Qadarun. Təqdir –*** Hər hansısa bir sualın həlli üçün hökm vermək deməkdir[1564]. Şəri mənası isə – Abdullah Cərqo deyir ki: «Qədər Allahın elminə uyğun olaraq yerin və göyün yaradılmasından əlli min il öncə Lövhi Məhfuzda bütün məxluqatın qədərinin yazılmasıdır. Bu qədər də Allahın iradəsinə uyğun olaraq təyin edilmişdir. Allahın istədiyi zaman da baş verir».

***Qada – Qəza –*** İstilahi mənası – son hökm, qərar, sona çatdırmaq, bitirmək, qurtarmaq deməkdir[1565]. Quranda və Sünnədə digər mənalarıda vardır ki, onlardan: Bir şeyi etmək, iki mübahisə edən şəxs arasında hökm vermək, Allah qada edib – şəriət edib, xəbər vermək, bir şeyi bitirmək, tamamlamaq və s. mənaları vardır. Ən məşhur mənası isə Allahın kovni əmridir. ***«Bir şeyi yaratmaq istədiyi zaman Allahın buyurduğu ona ancaq: «Ol!» deməkdir. O, da dərhal olar.*** *(Yəsin 82).* Abdullah Carqo deyir ki: «O, Allahın əşyaları yaratması və onları xəlq etməsidir - zamanı çatdıqda. Zamanı çatdıqda necə ki, onun qədərində yazılmışdır. Allahın hikmətinə, istəyinə uyğun olaraq». Bəzi alimlər qeyd edirlər ki, bunların mənaları eynidir. Ən səhih və doğruya yaxın olan yuxarıda verilən təriflərdir. İbn Battal – *rahmətullahi aleyhi* – deyir ki: "***Qəza –*** baş verən şey deməkdir (Yəni: Nə ki, artıq yaradılıb)"[1566]. Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: "***Qədər –*** Uca və Böyük olan Allah tərəfindən öncədən qərar verilmişdir. Məs: Dağıdılma, diriliş, ölüm. Bütün bu adlar Dağıdanın, dirildənin, öldürənin əməlləridir. ***Qəza –*** yaradlışdır. ***"Allah onları*** *(səmaları)* ***yeddi***

---

[1564] İbn Həcər "Fəthul Bəri" 1/118, Firuzabadi "Qamus" s. 591, Saffrani 1/348.
[1565] İbn Əsir "Nihayə" 4/78.
[1566] Fəthul Bəri 11/149.

*(qat)* ***göy olaraq iki gündə əmələ gətirdi...".*** *(əl-Fussilət 12)*[1567]. Beləcə ***Qədər*** **–** təqdir edilmiş, ***Qəza*** - nə ki, baş vermişdir və baş verməməsi mümkün deyildir"[1568]. Tavus – *rahmətullahi aleyhi* – deyir ki: "Mən bir neçə səhabə ilə qarşılaşdım ki, onların hamısı deyirdilər ki: "Hər bir şey təqdir edilmişdir". Həmçinin eşidim ki, İbn Ömər - *radıyallahu anhu* – deyir ki: "Hər bir şey təqdir edilmişdir. Hətta acizlik (zəiflik) və cəldlik"[1569]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki: "Bir gün Qureyş müşrikləri Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən Qədər barəsində soruşdular. Allah: ***"O gün onlar üzüstə Cəhənnəmə sürüklənəcək*** *(və onlara)**: "Duyun Cəhənnəmin*** *(ələmini)* ***təmasını!"*** *(deyiləcəkdir).* ***Şübhəsiz ki, Biz hər şeyi müəyyən ölçüdə*** *(lazım olduğu qədər)* ***yaratdıq".*** *(Qəmər 48-49)*[1570]. İbn Həcər – *rahmətullahi aleyhi* –, Raqib İsfəhani – *rahmətullahi aleyhi* – nin sözlərini rəvayət edərək deyir ki: "***Qəza*** və ***Qədər*** **–** təqdir edənin Güc və Qüvvət sahibi olduğuna işarədir..."[1571]. Allah kamil olaraq güc və qüvvət sahibidir. Onun üçün mümkün olmayan bir şey yoxdur. Onun İsimləri içərisində - ***əl-Qadir, əl-Qādir*** və ***əl-Muqtədir*** - vardır. İmam Əhməd – *rahmətullahi aleyhi* – dən ***Qəza*** və ***Qədər*** barəsində soruşduqda o: "***Qəza*** və ***Qədər*** **–** Allahın Qüdrətidir" deyə cavab vermişdir[1572]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "İmam Əhməd – *rahmətullahi aleyhi* – deyir ki: ***Qəza*** və ***Qədər*** - Allahın Qüdrətidir. İbn Aqil – *rahmətullahi aleyhi* – deyir ki: Bu sözlər İmam Əhməd – *rahmətullahi aleyhi* – nin dəqiqliyinə və dində dərin bilik sahibi olmasına dəlalət edir. ***Həmçinin*** Abu əl-Vafa – *rahmətullahi aleyhi* – da eyni sözləri söyləmiş və demişdir: "Allahın Qədərini inkar etmək özündə Allahın qullarının əməllərini yaratmasını, yazmasını və təqdir etməsini inkar etməkdir". İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Kim bizim Sələflərin yolu ilə getmirsə o, kimsə mahiyyət etibarıyla Allahın qüdrətini inkar etmiş olur. Cəhmilər və onların ardıcılları, Mötəzilə (əqidəsində olanlar) hansıki insanın seçiminin olmadığını və Qədəri inkar edilər...". İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Onlar deyirlər ki: "Xeyiri yaradan Şərii yaradan deyildir". Onlardan müsəlman olanlar isə deyirlər ki: "Günahlar Allahın istəyinə xilaf olaraq edilir". Digərləri isə: "Allah onlardan xəbərdar deyildir". Onla deyirlər ki: "Canlı məxluqatın bütün əməlləri Onun iştirakı olmadan edilir və Onun yaratdığı deyildir. Onlar qaçılmaz olaraq Allahı iradəsini və Onun sosuz Qüdrətini inkar edirlər. İbn Abbas - *radıyallahu anhu* – deyir ki: "***Qədər*** **–** Tövhiddə nizam intizamdır. Kim ki, Allahın təkliyinə və qədərə iman edirsə Tövhidi doğru olar. Kimdə Allahın təkliyinə iman edib, lakin qədər iman etməzsə küfrü ilə (tövhidi) də dağılar"[1573].

Bu kəlmələrin də İslam və İman, Miskin və Fəqir, Mömin və Müsəlman kimi həm ümumi, həm də xüsusi mənaları vardır. Qəza və Qədər kəlimələri də bir yerdə işləndikdə hərəsinin ayrı-ayrı mənaları vardır. Lakin bu sözlər ayrı-ayrı gəldikdə isə biri digərinin mənasını verir. Məs: Uşağın doğulması, bəlanın baş verməsi Allah tərəfindən əlli min il öncədən Qədərdə qeyd edilmişdir. Lakin uşağın bu gün doğulması, bəlanın bu gün baş verməsi isə artıq Allahın Qadasıdır. Qəza və Qədər özündə iki şeyi əhatə edir: **1)** Allahın əzəli elmini. **2)** Allahın bir şeyi yaratmasını.

---

[1567] Xattabi "Maalim Sünnə" 7/70.
[1568] İsfəhani "Mufadat" s. 406.
[1569] Müslim 2655.
[1570] Müslim 2656, əl-Albani "Səhih Sünən Tirmizi" 3/229.
[1571] İbn Həcər "Fəthul Bəri" 11/477.
[1572] Məcmuul Fətava 8/308.
[1573] Məcmuul Fətava 8/258.

Əziz müsəlman qardaş va bacılarım! Allahın qədər məsələsində olan fikir ayrılıqlarına görə müsəlman ümməti üç qrupa bölünür.

**1.** Bu – o, kəslərdir ki, Qədəri israr etməkdə həddi aşaraq insanın iradəsini, xeyir və şərr arasında seçim qabiliyyətini inkar etmişlər[1574].

Onlar deyirlər ki: «İnsanın nə iradəsi, nə də seçim qabiliyyəti vardır. O, öz əməllərini etməyə məcburdur[1575]. Əməllərin qula isnad edilməsi məcazdır. Qul namaz qıldı, oruc tutdu, öldürdü, oğurluq etdi deyilməsi eyni ilə günəş doğdu, külək əsdi, yağış yağdı kimidir». Beləliklədə onlar Rəbblərini zülm etməkdə və qulların güc yetirmədikləri şeyləri etməkdə ittiham etmiş oldular. Onlar insanın məcburiyyət qarşısında və könüllü surətdə etdiyi işlər arasında fərqi görməzlər. Şübhəsiz ki, onlar haqdan sapmışlar (azıblar). Çünki din sağlam düşüncə və həqiqət (haqq) onu sübut edir ki, (insanların) məcburiyyət qarşısında və könüllü surətdə etdiyi işlər (əməllər) arasında fərq vardır. İbni Mubarək – *rahmətullahi aleyhi* – deyir ki: «Biz Yəhudi və Xaçpərəstlərdən sözləri nəql edərdik. Lakin Cəhmiyyədən sözləri nəql etməzdik».

**2.** Bu – o, kəslərdir ki, qulun iradəsini və seçim qabiliyyətini israr etməkdə həddi aşaraq, nəticədə Allahın istəyini və qədərini inkar etmişlər. Onlar deyirlər ki: «Qulun əməlləri Allah tərəfindən yaradılmayıb, təmamilə insanın özündən aslıdır». Qulun qüdrət və iradəsi ilə öz əməllərinin yaradıcısı olduğunu irəli sürmüşlər. Bununla da Allahdan başqa iki yaradıcı olduğunu qəbul etmişlər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onları «Bu ümmətin məcusiləri» deyə adlandırmışdır. Çünki məcusilər şeytanın şərri və pisi yaratdığına inanaraq, Allah ilə birlikdə onun bir başqa yaradıcı olduğunu iddia edirlər. Bu qurup da qulları Allah ilə birlikdə yaradıcı olaraq qəbul etmişlər. İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qədəriyyə bu ümmətin məcusiləridir. Xəstələnəcək olurlarsa onları ziyarətə getməyin, ölürlərsə cənazələrində iştirak etməyin»[1576]. İbn Ömər -

---

[1574] İlk olaraq Qədər barəsində danışan Bəsrə sakini olan Sansavayh olmuşdur. əl-Auzai – *rahmətullahi aleyhi* – deyir ki: "Qədərdən ilk danışmağa başlayan İrak sakini olan Sausan olmuşdur. Xristian bir kimsə idi. Islamı qəbul etdikdən sonra yenidən Xristianlığa qayıdır. Onun görüşlərini özünə (əqidə) edən isə Məbəd əl-Cuhəni idi. Ondan isə öyrənən Qaylan olmuşdur". İbn Həcər "Fəthul Bəri" 10/179. Yunus b. Ubeyd – *rahmətullahi aleyhi* – deyir ki: "Bəsrədə olduğum zaman bunlardan başqa Qədəri yox idi: Sansavayh, Məbəd əl-Cuhəni və bir də Bəni Afvadan olan lənətlənmiş". Laləkai 3/749. Yəhyə b. Yamər deyir ki, Bəsrədə qədərdən ilk söz edən (yəni qədəri inkar edən) Məbəd b. Cuheyni idi. Onlar qədərin olmadığını və işlərin əzəldən Allahın təqdiri olmadan meydana gəldiyini söyləyirlər. Müslim 1/150. Məbəd əl-Cuhəni görüşləri Vasil b. Ata, Amir b. Ubeyd, Qaylan əd-Diməşkiyə ötrüldü. Vasil b. Ata – Mötəzilə əqidəsinin başçısı idi. Onlar deyirlər ki: "Qullar azad olaraq, Allahdan aslı olmayaraq öz pis və yaxşı əməllərini yaradır, kafir və ya mömin olurlar, Allaha asi olurlar və ya itaət edirlər. Hər bir şeyin Onun qədəri ilə baş verməsini də inkar edirlər". Əməvi xilafətinin sonlarında isə bəndələrin azad seçimini inkar edərək məcbur edildiyini söyləyən kimsələrdə çıxdı. Bunların başında Cəhm b. Saffan dururdu. Əbu Muxriz kimi tanınır. H. 128-ci il Mərvəzdə öldürülür. İbn Teymiyyə "əl-Fətava əl-Hənbəliyə əl-Kubra" deyir ki: "(Allahın bütün sifətlərini inkar edənlərdir) İlk olaraq bu fikirləri Cud İbn Dirhəm təbliğ etməyə başlamışdır. Ondan da Cəhm İbn Saffan bu fikirləri alır və yaymağa başlayır. Cəhmilər də ona nisbət edilərək belə adlanmışlar. Rəvayət edilir ki: Cud İbn Dirhəm bu görüşləri (fikirləri) Abana İbn Səbanadan, o da Talutdan, o da öz əmisi Lubeyd İbn əl-Əsləmdən almışdır. Lubeyd İbn Əsləm isə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - sehr (cadu) edən Yəhudi sehirbaz idi". Ömər b. Xeysəm rəvayət edir ki: "Bir gün gəmidə səfərə çıxmışdıq. Bizimlə bərabər gəmidə bir Qədəri və Məcusi də vardı. Qədəri: "İslamı qəbul et!" dedi. Məcusi: "Allah istəsə" dedi. Qədəri: "Allah istəyir, lakin şeytan istəmir" dedi. Məcusi: "Allah bir şey istəyir, şeytan başqa şey və Şeytanın istədiyi alınır. Bu güclü şeytandır. Daha yaxşı olar mən güclü olanla qalım" dedi. "Şərh Əqidətul Təhaviyyə" s. 278.

[1575] ***Cəbr – Cəbərilər –*** Məcburiyyət, məcbur edilmək deməkdir. Onlar deyirlər ki: Allah məcbur edir insanları bu və ya digər əməlləri etməyə. Bəzən onlara: "Azad seçimi inkar edən Qədərilər" deyilir. Uca və Böyük olan Allah barəsində bu cür düşünmək böyük bir xətadır. Allah Uca və Böyükdü ki, kimisə hər-hansısa bir işə məcbur etsin. Məcbur edə bilər O, kəs ki, onun istədmək iradəsi yoxudur. Allah bundan münəzzəhdir. Əbu Bakr əl-Həlləl – *rahmətullahi aleyhi* – "Sünnə" adlı əsərində deyir ki, əl-Marruzi – *rahmətullahi aleyhi* – İmam Əhməd – *rahmətullahi aleyhi* – deyir ki: "Ey Əbu Abdullah! Bir nəfər deyir ki: Allah məcbur edir?". İmam öz etirazını bildirərək: "Biz belə demirik. Lakin Allah istədiyini azdırır, istədiyini də doğru yola yönəldir". Məcmuul Fətava 8/103,463.

[1576] Əbu Davud «Aunul Məbud» 12/452, 4691, əl-Albani «Səhihul Cəmi» 5039, «Şərhu Təhaviyyə» s 273 həsən hədis.

*radıyallahu anhu* – belə deyənlərin sözlərinə bərk qəzəblənmiş, onlara ağır sözlər söyləmiş, onlardan uzaq olduğunu söyləmiş, əməllərinin üzlərinə geri çırpılacaqlarını, qədərə iman etmədikləri müddətdə əməl-lərinin əsla qəbul olunmayacaqlarını açıqca ifadə etmişdir. Bu sözlərin deyiliş səbəbi ona görədir ki, Yəhyə b. Yamər deyir ki, Bəsrədə qədərdən ilk söz edən (yəni qədəri inkar edən) Məbəd b. Cuheyni idi. Mən Humeyd b. AbdurRahman əl-Himyeri ilə birlikdə Həccə və ya Ümrəyə getmək üçün səfərə çıxdıq. Yolda: «Kaşki Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in səhabələrindən biri ilə qarşılaşardıq. Bu kimsələrin qədər haqqında söylədiklərinə dair ona sual verərdik. Bunu demişkən məscidin girişində İbn Ömər - *radıyallahu anhu*– ilə qarşılaşdıq. Mən və yoldaşım onun sağına və soluna keçdik. Birimiz sağ tərəfində, digərimiz isə sol tərəfində idik. Ey AbdurRahmanın atası! Bizim yaşadığımız yerdə Qurani Kərimi oxuyan, elm tələb etməkdə çalışan insanlar vardır. Onlar qədərin olmadığını və işlərin əzəldən Allahın təqdiri olmadan meydana gəldiyini söyləyirlər. İbn Ömər: «Onlarla qarşılaşdığınız zaman onlara deyin: «Şübhəsiz ki, mən onlardan uzağam, onlar da məndən uzaqdırlar. Allaha and olsun ki, onlardan birinin Uhud dağı boyda qızılı olub və onu Allah yolunda versə də belə, qədərə iman etməyənə qədər Allah bunu ondan qəbul etməz»[1577]. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mən ümmətimdə üç şeyin yaranmasından qorxuram. İmamların ədalət-sizliyindən, ulduzlara inanmaqdan və qədəri inkar etməkdən»[1578]. Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qul bu dörd şeyə inanmadıqca mömin olmaz. Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına və məni haqla göndərdiyi Rəsulu olduğuna şəhadət etmək. Öldükdən sonra dirilməyə inanmaq və Qədərə inanmaq»[1579]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Son zamanlarda Qədər barəsində ümmətimdən söhbət ən pis kimsələr (çıxacaqdır)"[1580]. Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Altı qrup insan vardır ki, mən onlara lənət edərəm, Allah onlara lənət edər və bütün nəbilər onlara lənət edər. Qədəri inkar edən…»[1581]. Bu qrupun bəzi nümayəndələri həddi aşaraq deyirlər ki: «Allah yaratdıqlarının etdikləri əməllər barəsində yalnız onlar bu əməlləri etdikdən sonra xəbər tutur». Onlar insanın istəyi və seçimi barəsində ifrata yol vermişlər. Nəfi – *rahmətullahi aleyhi* –deyir ki, bir nəfər İbn Ömər - *radıyallahu anhu* – nun yanına gələrək ona birisinin salamını çatdırdı. İbn Ömər: "Mən eşitmişəm ki, o küfrə düşmüşdür. Əgər bu belədirsə məndən ona salam çatdırma. Çünki mən Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in belə buyurduğunu eşitdim: «Mənim ümmətimin başına eybəcərlik, uçulma və daş yağma gələcəkdir. Bütün bunlar Qədərilərin başına gələcəkdir"[1582]. İmam Məlik – *rahmətullahi aleyhi* – dən: «Qədəriyyə mənsub kimsələrlə əlaqəni kəsimmi?». O: «Əgər getməkdə olduğu yolu bilən birisidirsə bəli. Həmçinin də onların arxasında namaz qılma»[1583]. İmam Məlik – *rahmətullahi aleyhi* – dən: «Qədəriyyəyə mənsub bir kimsəyə qız verməyə dair sual verildi» o, da: «əl-Bəqərə 221-ci ayəsini oxudu: ***«Həmçinin müşrik kişilər Allaha***

---

[1577] Müslim «İman» 1.
[1578] İbn Əsakir, Əbu Yala, əs-Suyuti, əl-Albani "Səhih Cəmi" 212.
[1579] Tirmizi 2146, İbn Məcə «Muqəddimə» 81, Həkim.
[1580] əl-Albani "Səhih Cəmi" 224.
[1581] Tirmizi 2155.
[1582] Tirmizi 2152, əl-Albani "Həsən".
[1583] Qadi İyad «Tərtibul Mədarik» 2/47.

***iman gətirməyənə qədər mömin qadınları** (onlara) **ərə verməyin»***[1584]**.** İmam Şafii – *rahmətullahi aleyhi* – də: «Qədəriyyəyə mənsub bir kimsənin arxasında namaz qılmağı məkruh görürdü»[1585]. İmam Şafii – *rahmətullahi aleyhi* – deyir ki: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in bu ümmətin məcusiləri dediyi qədəriyyəyə mənsub kimsələr Allah, günahlar olunana qədər bilməz deyən kimsələrdir»[1586]. İmam Şafii – *rahmətullahi aleyhi* – deyir ki: «Qədəriyyə nə deməkdir bilirsinizmi? Özü bir iş etmədikcə Allah da bir şey yaratmamışdır deyən kimsədir»[1587]. İmam Əhməd – *rahmətullahi aleyhi* – dən qədəriyyəyə mənsub birinin arxasında namaz qılmaq haqqında soruşuldu o, da: «(Bidət fikirlərinə) dəvət edən birisidirsə namaz qılma»[1588].

**3.** Bu – o, kəslərdir ki, iman gətirib və Allahda onları bu məsələdə haqq yoluna yönəltmişdir. Bunalar – Sünnə tərəfdarları olan Əhli Sünnə Vəl Cəmaatdır. Onlar şəriətin dəlillərinə (Quran və Sünnə) və qərəzsiz məntiqə əsaslanaraq bu azmış iki firqənin ortasında Vasat – orta yolu tutan kimsələrdir. Onlar deyirlər ki: «Allahın kainatda yaratdığı hər bir şey iki qrupa bölünür.

**1)** ***Kovni İradə*** **-** bu o, şeylərdir ki, Allah öz yaratdıqlarının arasında yaradır və heç kəs də onları dəyişdirmək qüdrətinə malik deyildir. Məs: Yağışın yağması, bitkilərin cücərməsi, doğulmaq, ölmək, xəstəlik, şəfa və s. kimi Allahın yaratdıqları ilə baş verən hadisələr. Heç kəs bunlardan qaça bilməz və heç kəs bunlar arasında seçim edə bilməz. Çünki bunlar yalnız və yalnız Allahın istəyi ilə baş verir. ***«Allah kimi düz yola yönəltmək istəsə, onun köksünü İslam** (dini) **üçün açıb genişləndirər, kimi azdırmaq istəsə, onun ürəyini daraldıb sıxıntıya salar. O, sanki** (sıxıntının şiddətindən) **göyə çıxar. Allah iman gətirməyənlərə pisliyi belə edər!»*** *(əl-Ənam 125).* ***«Əgər Allah sizi** (haqq yoldan) **azdırmaq** (və ya məhv etmək) **diləyirsə, mən sizə nəsihət vermək istəsəm də, heç bir faydası olmaz. O, sizin Rəbbinizdir və siz Onun hüzuruna qaytarılacaqsınız».*** *(Hud 34).* İmam Şafii – *rahmətullahi aleyhi* – deyir ki: «Qulların diləməsi Allaha aiddir. Aləmlərin Rəbbi olan Allah diləmədikcə onlar diləyəməzlər. İnsanlar öz əməllərini yaratmamışlar. Onların əməlləri Allahın yaratdıqları arasındadır. Qulların əməlləri Onun tərəfindən yaradılmışdır. Qədərin xeyiri və şərri də Allahdandır» .

**2)** ***Şəri İradə*** – bu o, əməllərdir ki, yaradılmışların şəxsi iradəsi və istəyi ilə olur. Bu əməllər yaradılmışların istəyi ilə olur, hansıki Allah onlara bəxş edib. ***«Eləcə də sizdən doğru-düz** (yolda) **olmaq istəyənlər üçün.** (Onu da bilin ki) **aləmlərin Rəbbi olan Allah istəməsə, siz** (bunu) **istəyə bilməzsiniz».*** *(ət-Təkvir 28-29).* ***«İçərinizdən bəziləri dünyanı, bəziləri isə axirəti istəyirdi».*** *(Ali İmran 152).* ***«Allah sizə bilmədiklərinizi bildirmək, sizdən əvvəlkilərin getdiyi yolları göstərmək və tövbələrinizi qəbul etmək istər. Allah hər şeyi biləndir və hikmət sahibidir! Allah sizin tövbələrinizi qəbul etmək istəyir. Öz nəfsinə uyanlar isə sizi böyük bir əyriliklə düz yoldan sapdırmaq istəyirlər. Allah istər ki, üzərinizdə olan ağırlığı yüngülləşdirsin, çünki insan zəif yaradılmışdır».*** *(ən-Nisa 26-28).* ***«Allah sizi çətinliyə salmaq istəməz, lakin O sizi pak, təmiz etmək və sizə olan nemətini tamamlamaq istər ki, bəlkə şükr edəsiniz!»*** *(əl-Maidə 6).* ***«Allah sizdən çirkinliyi yox etmək və sizi tərtəmiz, pak etmək istər!»*** *(əl-Əhzab 33).*

---

[1584] İbn Əbi Asim «Sünnə» 1/88, Hilyə 6/326.
[1585] Beyhəqi «Mənakibus Şafii» 1/413.
[1586] Beyhəqi «Mənakibus Şafii» 1/413.
[1587] əl-Laləkai «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Cəmaat».
[1588] əs-Sünnə 1/384.
[1589] Beyhəqi «Mənakibus Şafii» 1/413.

Dərrakəli insan könüllü surətdə və məcburən etdiyi (əməllər) arasında fərqi dərk edir. Əgər insan öz istəyi ilə evin damından nərdivan ilə düşürsə, bu əməli özü etdiyini başa düşür. Əgər o, evin damından öz istəyi olmadan aşağı yıxılırsa, onda o, bu iki əməl arasında fərqi görür. Çünki birinci əməl onun öz istəyi ilə, ikinci əməl isə (onun istəyi olmadan) məcburi baş verir. Bu da hər bir insana aydındır.

Uca və Böyük Allahın rəhmətinin və mərhəmətinin genişliyinə görə insan öz istəyi ilə etdiyi bəzi əməllərinə görə heç bir məsuliyyət daşımır. Məs: İnsan unudaraq etdiyi əməllərinə görə və ya yuxuda yatarkən etdiyi əməllərinə görə heç bir məsuliyyət daşımır. Mağara əhlindən danışarkən Allah buyurur: *«(Gözləri açıq olduğu üçün)* ***onlar yuxuda ikən sən onları oyaq sanardın.*** *(Torpağın rütubəti bədənlərini çürütməsin deyə)* ***Biz onları sağa-sola çevirirdik».*** *(əl-Kəhf 18).* Sağa-sola çevrilən insanlar olduqları halda Allah bu əməli özünə aid edir. Çünki yatan seçim qabiliyyətinə sahib olmadığı üçün yatdığı vaxt etdiyi əməllər barəsində ondan heç bir sorğu-sual olunmayacaqdır. Buna görə də Uca və Böyük olan Allah bu əməli özünə aid edir. Həmçinin Rəsulullah – *sallallahu aleyhi və səlləm* –buyurur: «Üç şəxsin üzərindən qələm qaldırılmışdır. Yatan şəxs ayılana qədər, uşaq həddi-buluğa catana qədər və dəli ağlı başına gələnə qədər»[1590]. Başqa bir hədisdə Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurur: «Sizdən biriniz (oruc vaxtı) unudaraq yeyərsə və ya içərsə (qoy orucunu pozmayıb) axıra çatdıraraq tamamlasın. Heç şübhəsiz ki, Allah onu yedirdib və içirmişdir»[1591]. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu ki, oruc tutanı yedirdən də, içirdən də Uca Allahdır və bu əməli məhs ona aid edir. Belə bir kimsə oruclu olduğunu unudaraq yeyib içdiyinə görə seçim, qabiliyyətindən məhrum olan kimsəyə bənzəyir. Bundan başqa hər bir insan onun istəyi və iradəsi olmadan, hətta onların yaranma səbəblərini də bilmədən yaranan ağrı və qorxu arasında olan fərqi də görür. Həmçinin də öz istəyi ilə yaranan ağrı və sevinc arasında fərqi də görür. Bütün bu gətirdiyimiz nümunələr açıq-aydın və heç bir şəkk-şübhə doğurmayandır.

Əziz müsəlman qardaş və bacılarım! Əgər biz birinci qrupun dediyi kimi qədərdə həddi aşaraq insanın heç bir seçimi olmadığını israrla qeyd etsək, onda Allahın şəriətinin lazımsız olduğunu da qeyd etmiş oluruq. İnsanın istək və iradə haqlarının olmadığını qeyd etməklə qulu xeyirli işlərə həvəsləndirmək və pis işlərdən çəkindirməyin də lazımsız olduğunu qeyd etmiş oluruq. Belə ki, qulun bu əməlləri etməkdə heç bir seçim haqqı yox idi və nəticədə Uca və Böyük olan Allah ona asi olanları cəzalandırsa çox böyük ədalətsizlik etmiş olar. *Sübhənəllah!* Allah pak və nöqsansızdır. Şübhəsiz ki, bütün bunlar açıq-aydın Quran ayələrinə ziddir. Allah buyurur: ***«Yoldaşı*** *(ona)* ***təhkim olunmuş mələk deyəcəkdir: «Bu yanımdakı*** *(Cəhənnəm üçün)* ***hazırdır!»*** *(Allah o, iki mələyə buyuracaqdır)****: «Atın Cəhənnəmə hər bir inadcıl kafiri, xeyrə mane olanı*** *(zülm etməklə, günah törətməklə)* ***həddi aşanı,*** *(Allahın birliyinə)* ***şəkk edəni! O, kimsəni ki, Allahla yanaşı özünə başqa bir tanrı qəbul etdi. Atın onu şiddətli əzabın içinə!» Yoldaşı*** *(şeytan və ya öz nəfsi)* ***deyəcəkdir: «Ey Rəbbimiz! Onu mən azdırmadım. Lakin o, özü haqq yoldan açıq-aydın azmışdır!»*** *(Allah buyuracaqdır)****: «Mənim hüzurumda mübahisə etməyin. Mən sizə*** *(dünyada Peyğəmbər vasitəsi ilə)* ***bu əzabı bildirmişdim. Mənim hüzurumda söz güləşdirməyin. Mən bəndələrə*** *(səbəbsiz yerə)* ***zülm edən deyiləm!».*** *(Qaf 23-29).*

---

[1590] Əbu Davud.
[1591] Buxari, Müslüm.

Allah bu ayədə açıq-aydın bəyan edir ki, qulun cəzası ədalətsizliklə (haqsızlıqla) deyil, əksinə ədalətlə olunan bir işdir. Çünki artıq Allah öz qullarını bundan çəkindirmiş və onlara halal ilə haramı, doğru yol ilə zəlalət yolunu bəyan etmişdir. Lakin onlar zəlalatə uğrayanların və azğınların yoluna uymağa üstünlük verdilər və indi də Uca və Böyük olan Allahın yanında heç bir bəhanələri də yoxdur. ***«Biz Peyğəmbərləri** (möminlərə) **müjdə gətirən və** (kafirləri) **əzabla qorxudan kimi göndərdik ki, daha insanlar üçün Peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın. Allah yenilməz qüvvət və hikmət sahibidir».** (ən-Nisa 165).*

O, ki qaldı ikinci qrup insanlara, onların dedikləri də Quran və Sünnə tərəfindən və ətrafda baş verən hadisələrlə təqzib olunur. Quran ayələri dəlildir ki, qulun istəməsi Allahın istəyinə bağlıdır. ***«Eləcə də sizdən doğru-düz** (yolda) **olmaq istəyənlər üçün.** (onu da bilin ki) **aləmlərin Rəbbi olan Allah istəməsə, siz** (bunu) **istəyə bilməzsiniz».** (ət-Təkvir 28-29). **«Rəbbin istədiyini yaradar və seçər. Onların heç bir ixtiyarı yoxdur».** (əl-Qəsəs 68). **«Allah** (bəndələrini) **əmin-amanlıq yurduna** (Cənnətə) **çağırır və istədiyini doğru yola salır!»** (Yunus 25).* Allahın iradə və istəyini inkar edənlər əslində Allahın Rəbb olmasını inkar etmiş olurlar. Çünki onlar iddia edirlər ki, Allahın mülkündə baş verən hadısələr onun istək və iradəsi olmadan baş verir. Heç bir şey və heç bir hadisə Allahın ona istəyi olmadan baş vermir və yalnız Allah hər bir şeyin yaradıcısıdır. O, hər bir şeyin qədərini müəyyən edir.

Bu kimsələrin dedikləri ağıl baxımından da səhfdir. Çünki bütün məxluqlar Uca və Böyük olan Allaha məxsusdurlar. Hər bir şey Allaha məxsus olduğu üçün də Allahın mülkündə nəinsə onun istəyinə zidd olaraq baş verməsi də mümkün deyildir. Lakin burada belə bir sual ortaya çıxır. Əgər hər şey Allahın istəyi və iradəsilədirsə, hər şey Allaha məxsusdursa onda qulun bu aləmdə rolu nədir? Axı artıq Allah kiminsə qədərində haqq yoldan azacağını və zəlalətə düşəcəyini yazmışdır.

Bu suala cavab verərək biz deyirik ki, Uca və Böyük olan Allah doğru yola yönəldir o, kəsləri ki, buna layiqdirlər və azdırır o, kəsləri ki, buna layiq deyillər. ***«Onlar** (haqdan) **üz döndərdikdə Allah da onların qəlblərini** (imandan) **döndərdi»** (əs-Səff 5). **«Sonra əhdlərini pozduqları üçün onları lənətlədik və ürəklərini sərtləşdirdik. Onlar sözlərin yerlərini dəyişib təhrif edir və xəbərdar edildikləri şeylərin bir hissəsini unudurlar».** (əl-Maidə 13).* Belə ki, Allah bu ayələrlə bəyan edir ki, qulun azmasına səbəb elə özüdür. Qul Allahın onun qədərində nəyi yazdığını bilmir. O, bu haqda yalnız (hadisə, iş) baş verdikdən sonra bilir. Allahın onu doğru yola yönəldəcəyi və ya haqq yoldan azacağı haqda onda heç bir məlumat yoxdur. Bəs nəyə insan zəlalət yolunu seçir və sonra da bəyan edir ki, bunu Allah belə istəyib. Məgər yaxşı olmazdır ki, insan haqq yola yönəlsin və sonra da bəyan etsin ki, Allah məni doğru yola yönəldib.

Bəs nə üçün insan günah etdikdə qədəri məsəl çəkir, xeyirli işlər etdikdə isə qədəri inkar edərək bəyan edir ki, bunları mən özüm etmişəm. Xeyr! Qula yaraşmaz ki, günah işlədikdə qədəri məsəl çəkərək desin: «Bu belə də olmalı idi. Mən Allahın yazdığı qədərdən qaça bilməzdim». Həmçinin qul xeyirli işlər edir və Allah da onu doğru yola yönəldirsə (insan) lovğalığından, təkəbbürlüyündən deməmlidir ki: «Bunun səbəbi yalnız mən özüməm. Mən özüm buna nail olmuşam».

Hər bir kəsin önündə müəyyən imkanlar açılmışdır və həmçinin də hər bir kəs seçimə də sahibdir. Hamıya yaxşı məlumdur hər bir kəsin ruzisi, həyatı, dünyalıq azuqəsi Allah tərəfindən qədərdə müəyyən edilmişdir. Lakin buna baxmayaraq hər bir

kəs ruzi, azuqə axtarışı üçün dəridən qabığdan çıxır, müəyyən məsafələr qətt edir. Hətta bəziləri bu məqsədlərlə başqa ölkələrə də səfərlər edirlər. Lakin elə bir insan yoxdur ki, evində oturaraq desin ki: «Mənim ruzim yazılıb, mən də onu alacağam». Əksinə o, hər cür vasitələrə əl atır ki, özünü və ailəsini dolandırsın. Əbu AbdurRahmən Abdulla b. Məsud – *radıyallahu anhu* – rəvayət edir ki, doğru sözlü və doğru sözü təsdiq olunan Rəsulullah - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizdən hər birinizin yaradılışı onun anasının qarnında qırx gün nütfə şəklində olaraq bir yerə gətirilir. Sonra bu müddət qədər aləqa şəklində olur. Sonra yenə bu müddət qədər mudğa şəklində olur. Sonra ona bir mələk göndərilir, mələk ona ruh üflədikdən sonra dörd xüsusiyəti yazmaqla əmr olunur. Ruzisini, əcəlini, əməlini, bədbəxt və ya xoşbəxt olacağını» . Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah ana bətninə bir mələk (göndərər) və mələk: "Ya Rəbbim! Nütfə, Ya Rəbbim! Aləqa, Ya Rəbbim! Mudğa". Allah onu xəlq etmək istədikdə (Mələk): "Oğlan yoxsa qız, xoşbəxt yoxsa bədbəxt, Ruzisi nədir? Əcəli Nədir?". Bütün bunlar ana bətində ikən yazılır"[1596]. Əbu Zərr - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Nütfənin (Ana bətinə) düşməsindən 42 gecə keçdikdən sonra Allah bir mələk göndərər. Mələk ona şəkil verərək: eşitmə, görmə, dəri və sümük (şəkilini) verər. Sonra: "Ya Rəbbim! Oğlan, yoxsa qız?" deyə soruşar. Bu zaman Allah öz iradəsini (qədərini) əmr edər və mələk də yazar"[1597].

Qulun ruzisi müəyyən olunduğu kimi, onun yaxşı və pis əməlləri də müəyyən olunmuşdur. Bəs onda nəyə görə sən dünya həyatını gözəlləşdirmək üçün hər cür vasitələrdən istifadə edirsən. Lakin gələcək hayatını, axirət yurdunu gözəlləşdirmək üçünsə xeyirli işlərdən uzaq durursan. Həyatını gözəlləşdirilməsi, abadlaşdırılması üçün çalışırsan, özünü xəstəliklərdən qorumaq üçün sağlamlığının qayğısına qalırsan. Xəstələndikdə ən yaxşı həkim axtarırsan ki, səni müalicə etsin. Lakin buna baxmayaraq artıq sənin ömrün müəyyən edilmişdir. O, nə artacaqdır, nə də azalacaq. ***«Allahın izni olmayınca heç kəsə ölüm yoxdur. O,*** (lövhi məhfuzda) ***vaxtı müəyyən edilmiş yazıdır.*** *(Ali İmran 145).* ***«Hər ümmətin bir əcəl vaxtı vardır. Onların əcəli gəlib çatdıqda bircə saat belə nə yubanar, nə də tələsərlər».*** *(Yunus 49).* ***«Ömür sahibi olan birinin uzun ömür sürməsi də, onun*** *(yaxud başqa birinin)* ***ömrünün qısaldılması da ancaq kitabda*** *(lövhi məhfuzda)* ***yazılmışdır. Həqiqətən bu Allah üçün çox asandır».*** *(Fatir 11).* Lakin buna baxmayaraq sən demirsən ki: «Qoy mən yatağımda qalım. Əgər Allah ölümü yazıbsa öləcəyəm, yox əgər yaşamağı yazıbsa deməli yaşayacağam». Əksinə sən var gücünlə çalışırsan ki, yaxşı həkim tapasan və onun əlləri ilə Allahın yazılmış olduğu şəfanı tapasan. Bəs nə üçün sən Allahın rəhmini, mərhəmətini və Cənnətini qazanmaq üçün doğru yolu axtarmırsan. Bu yolda çalışmırsan.

İndi isə sənin qarşında iki yol açılır. Onlardan biri səadətə, xoşbəxtliyə, uğura, digəri isə ölümə, məyusluğa, zəlalətə aparır. Sən də bu yolların qarşısında seçim haqqına maliksən və heç kəs də sənə bu iki yoldan hansınısa seçməkdə maneçilik

---

[1592] ***Nütfə –*** məni mənasındadır. Nütfə bəzən də saf su adlanır.
[1593] ***Aləqa –*** laxtalanmış qan, ziyil deməkdir. ***«O, insanı laxtalanmış qandan yaratdı».*** *(əl-Ələq 2).*
[1594] ***Mudğa –*** çeynənilmiş ət parçasına oxşadığı üçün bu ad verilmişdir.
[1595] Buxari 3208, Fəthul Bəri 11/477, Müslim 2643.
[1596] Buxari 6595, Fəthul Bəri 11/477, Müslim 2646.
[1597] Müslim 2645.

törədə bilməz. İstədiyin yolu seçib o, yolla da gedə bilərsən. Lakin haqdan üz döndərib sonra da demə ki: «Mənim üçün belə yazılmışdır». Əksinə yaxşı olardı sən doğru yolu seçib sonra da deyəsən ki: «Mənim qədərimdə elə bu yazılmışdır» Amin.

## QƏDƏR ALLAHIN SİRRİDİR

Qədərin əsli Allahın sirridir. O, haqda biliyə nə bir mələk, nə bir peyğəmbər, nə də onlardan aşağı olan hər hansı bir insan sahib deyildir. Bu haqda dərinliyə dalmaq, düşünmək və cürbəcür fikirlər yürütmək doğru deyildir. Allahın gizli sirri olduğu üçün sən bunu bilmək iqtidarında deyilsən. Qəza və Qədərə iman etmək imanın dayaqlarından biridir və bu Quran və Sünnə ilə sabitdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – açıqlamışdır ki, Qədərə iman etmək saleh əməli tərk etmək və istənilənə (arzu) edilənə çatmaq üçün çalışmamaq deyildir. Bütün bunlar Qədərə iman etməyə zidd olan bir şeylər deyildir. Bir gün səhabələr Qədər barəsində mübahisə etdikləri zaman Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – qəzəbli halda onların yanına çıxdı. Qəzəbdən yanaqları qıpqırmızı idi. Sanki nar suyunu üzünə çilənmişlər. O: "Məgər bu sizə əmr edilmişdir? Və ya mənim sizə gətirdiyimdir? Həqiqətən sizdən əvvəlkilər bu barədə mübahisə etdikləri üçün məhv oldular. Mən sizləri bu barədə mübahisə etməkdən çəkindirirəm"[1598]. İbn Həcər – *rahmətullahi aleyhi* –, Ənu Muzəffər əs-Samani – *rahmətullahi aleyhi* – sözlərini qeyd edərək deyir ki: "Qədər məsələsində haqqı öyrənmək üçün yalnız Quran və Sünnədən gələn ilə kifayətlənmək lazımdır. (Bu məsələdə) ağıl və fikirlərə ehtiyac yoxdur. Kim bu iki qaynaq ilə kifayətlənməyib dərinliyə girərsə okean sularında qərq olar. Çünki Qədər Allahın sirlərindəndir. Bu haqda yalnız Allaha məlumdur. Digər məxluqlar üçün isə naməlumluq hicabı ilə örtlüdür. Allah Qədəri insan ağlı üçün qeyri-mümkün etmişdir. Bunda isə böyük hikmətlər vardır. Hətta Peyğəmbərlər, Rəsullar və Mələklər üçün də naməlum etmişdir"[1599]. İmam Təhavi – *rahmətullahi aleyhi* – deyir ki: "***Qədər –*** Allahın sirridir. Bu sirr isə nə mələklərə, nə də Peyğəmbərlərə məlumdur. Bu məsələdə dərinliyə girmək – müvəffəqiyətsizliyə addım atmaq, məhrum olmaq, günah (qazanmaq) və vacibdir var gücünlə (bu məsələdən) düşünməkdən, mühakimə etməkdən, öyrətməkdən (öyrənmək-dən) çəkinməkdir. Allah Qədər barəsində olan elmi insanlardan gizləmiş və onu öyrənməyi də qadağan etmişdir. Allah: *"(Allah)* ***gördüyü işlər barəsində sorğu-sual olunmaz; onlar*** *(bütün bəndələr)* ***isə*** *(tutduqları əməllərə görə)* ***sorğu-sual ediləcəklər".*** *(əl-Ənbiya 23)*[1600]. İmam əl-Acurri – *rahmətullahi aleyhi* – deyir ki: "...Bəndələrin üzərinə düşən Qədərə iman edib – yaxşı və pis olan hər bir şeyin artıq təqdir edildiyinə və kim də bu məsələdə dərinliyə varıb aydınlaşdırma aparmağa çalışarsa, bəndələrin əməllərinin təqdir edilməsində (Cənnət və ya Cəhənnəmlik olmasında və s.) şübhə edərək yolundan azar". İmam Əhməd – *rahmətullahi aleyhi* – deyir ki: "Qədərin xeyir və şərrinə də iman etmək vacibdir. Bu barədə varid olan hədisləri də qəbul edib iman gətirmək lazımdır. "Nə üçün? Necə? (Nə cür?)" sualları verilməməli (soruşul-mamalı). Sadəcə bunları qəbul edib iman gətirmək lazımdır. Əgər insan hədisi oxuyub orada olan mənanı başa düşə bilmirsə onun üzərinə düşən anladığı ilə kifayətlənməsidir. Buna iman edib, itaət etməlidir. Məs: Əbu AbdurRahmən

---

[1598] əl-Albani "Səhih Sünən Tirmizi" 2/223.
[1599] Fəthul Bəri 11/477.
[1600] "Şərh Əqidətul Təhaviyyə" s. 276.

Abdulla b. Məsud – *radıyallahu anhu* – rəvayət edir ki, doğru sözlü və doğru sözü təsdiq olunan... və s. Qədər barəsində olan hədislər kimi"[1601]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Bir çox insanlar başa düşmək və haqqı tapmaq üçün bu məsələni müxtəlif istiqamətlərdən araşdırmışlar. Müxtəlif millətlər keçmişdə də, hal-hazırda da bu məsələnin mahiyyətini başa düşmək üçün çalışmışlar. Bir çox məzhəblər bu məsələni müxtəlif şəkildə başa salmağa çalışmış və bu barədə bir çox əsərlərdə yazmışlar. Lakin kim ki, bu məslədə dərinliyə varamış və məsələni kökündən öyrənməyə çalışmışsa şübhələrə düşmüş və (insanlarla) ixtilaf etmişdir. Hər bir kəs də öz yolunu (fikirlərini) doğru və ən səhih hesab etmişdir. Lakin haqqa tabe olanlardan başqa onların hamısı xəta etmiş və haqdan uzaq düşmüşlər..."[1602]. Kim ki, öz ağlı ilə bu məsələdə dərinliyə varmağa çalışmışsa zəlalətə uğramış və məhv olmuşlar. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in yolundan yayınaraq insanın seçim etməsini inkar etmiş (Cəbərilər), Digərləri isə: Allah yalnız xeyir yaradır, pisliyi istəyə bilməz (Qədərilər) deyərək qədəri inkar etmişlər. İbn Əbil İzz əl-Hənəfi – *rahmətullahi aleyhi* – deyir ki, bir çox kimsələrin bu məsələdə azmalarına səbəb Allahın Kovni İradəsi ilə Şəri İradənin arasını ayır edə bilməmələrinə görədir. O, deyir ki: "Allah sevmədiyi və xoşlamadığı bir şeyi necə iradə (istəyə) bilər? Allah necə belə bir şeyi istəyə və yarada bilər? Allahın iradəsini sevmədiyi və nifrət etdiyi bir şeylə necə uyğunlaşdırmaq olar? Bu o, suallardır ki, bunların səsəbilə insanlar qruplara ayrılmış, fikirləri və yolları da bir-birindən ayrılmışdır. Bir şeyi bilmək lazımdır ki, bir şeyi iradə (istəmək) etmək o, (istənilən) şeyin özünə görə də ola bilər və ya başqasına görə də (onu) istəmək olar. O, (istənilən) şeyin özünə görə olanlar, özünə görə və onda olan xeyirə görə də sevilir. Bu da istəyənin (iradə) edənin niyət və qəsdini (məqsədini) müəyyən edir. Başqasına görə istənilən (arzu edilən) özü-özlüyündə sevilən (istənilən) deyildir və xeyir də gətirmir. Lakin başqa bir istənilənə çatmaq üçün hədəfdir (və ya həyata keçirmək üçün hədəfdir). Belə şeylər özü-özlüyündə istəkli deyildir, lakin istəklidir başqa məqsədə çatmaq üçün. Bax buna görə də sevəməmək (xoşlamaq) və iradə (istək) uyğunlaşır və bir-birinə zidd də deyildir. Məs: İnsanlar acı dərmanı içirlər, onların müalicəvi olduğunu bildikləri üçün, hər hansısa bir cərrahiyə əməliyyatına girirlər, həyatlarını qorumaq üçün və ya uzun, ağır səfərlərə çıxırlar bütün bunların onları öz məqsədlərinə çatdıqlarını bildikləri üçün. Dərrakəli insan elə bir xoşa gəlməz şeylərə girir ki, hətta sonunun nə ilə nəticələndiyinə arxayın olmadığı halda (yalnız və yalnız) müəyyən ehtimallarla ki, bu ona sonda xeyir gətirəcəkdir. Bəs onda hər bir şeydən xəbərdar olan (hər bir şeyin içini və zahirini də bilən) Allah barəsində nə demək olar? Ona – hansısa bir iradə edilən, böyük bir xeyirin həyata keçməsi üçün, hansısa bir şey istəkli olmaya bilir. Məs: İblisin xəlq edilməsi. Onun səbəbindən dinlər dağıdılmış, bir çox qullar bədbəxt olmuş və öz əməlləri ilə Uca və Böyük olan Allahı qəzəbləndirmişlər. İblis səylə Allahın sevmədiyi və nifrət etdiyi əməlləri edir. Lakin məxluqlar onun mövcudluğundan bir çox Allahın sevdiyi ibrətlər (faydalar) alırlar. Bu xeyirin çıxarılması Onun üçün sevimlidir, nəinki onun yoxluğu. Məs: İblisin mövcuduluğu onun əksinin yaranmasına səbəb olmuşdur. Allah iblisi ən xəbis, çirkin, hər bir şərrin səbəbi olaraq yaratmışdır. Digər tərəfdən Allah Cəbrail - *əeyhissəalm* – ı ən gözəl bir biçimdə xəlq etmiş, bütün xeyirin səbəbi etmişdir. Hər ikisini də xəlq edən Uca və Böyük olan Allah hər bir həmd və tərif layiqdir. Onun qüdrətinin nişanələrindən gecə

[1601] Ləlәkai 3/157.
[1602] "Şifaul Alil" s. 14.

və gündüzün, xəstəlik və dərmanın, həyat və ölümün, xeyir və şərrin yaradılmasıdır. Bu Allahın qüdrətinin, qüvvətinin və mülkünün ən baris nümunəsidir. Allah bu zidd olan şeyləri yaratmış və onları bir-birinə qarşı qoymuşdur. O, onları əmr və idarə edir. Əgər bunlardan biri olmasaydı Onun hikmətinə və mülkünün kamilliyinə inanmaq mümkün olmazdı. İblisin mövcudluğu Allahın İsimlərinin: ***əl-Qahhar, əl-Muntəqim, əl-Adl, əd-Darr, Şədidul İqab, Səriul İqab, Zul Bətş əş-Şədid, əl-Xafid, əl-Muzill*** – olmasına səbəbdir. Bu İsimlər və onlara uyğun (müvafiq) olan əməllər – bu (İsimlərin) sahibinin kamilliyinin təzahürüdür. Əgər cin və insanların (yaradılış) təbiəti mələklərin (yaradılış) təbiətindən fərqlənməsəydi bu zaman bu İsimlər də izhar olmazdı. ***Həmçinin*** - İblisin mövcudluğu Allahın İsimlərindən: əs-Səbur, Yumşaqlıq (mərhəmət), Bağışlamaq və günahları örtmək, güzəştə getmək və qullarından istədiyini cəzadan qurtarmaq – kimi sifətlərinin olmasına səbəbdir. Əgər Allah sevmədiyi səbəbləri yaratmış olmasaydı bu İsimlərə uyğun olan hikmət tələb olunmamış qalardı. Peyğəmbər buyurdu: "Əgər siz günah etməsəniz Allah sizin yerinizə elə bir qrup (insanlar) gətirər ki, onlar günah edər və Allahdan bağışlanma diləyərlər. Allah da onları bağışlayar"[1603]. ***Həmçinin*** - İblisin mövcudluğu Allahın elm və hikmətlə bağlı olan İsimlərindən: ***əl-Həkim, əl-Xabir***. O, istənilən şeyi uyğun və layiq olan şəkildə öz yerinə qoyan. O, öz eliminin və hikmətinin kamiyyiyi ilə rəhbərlik edir. Risaləti kimə endirdiyini O, daha gözəl bilir, O, daha gözəl bilir kim bunları qəbul etməyə daha layiqdir və buna görə Ona şükr (və həmd) edəcəkdir və kimdə buna layiq deyildir. Əgər Onun sevmədiyi səbəblər olmasaydı bir çox xeyirlər də olmazdı. Əgər şərə gətirən səbəblər olmasaydı, onda bu səbəblərdən əmələ gələn və o, şərdən daha çox olan xeyir də olmazdı. Günəş, yağış, külək verdikləri ziyandan daha çox xeyir də gətirirlər. ***Həmçinin*** - İblisin mövcudluğu bir çox ibadətlərin olmasına da səbəbdir. Əksi təqdirdə bu ibadətlər də olmazdı. Cihad Allah üçün olunan ən gözəl ibadət növlərindəndir. Əgər bütün insanlar mömin olsaydılar onda nə Cihada, nə də onunla bağlı olan dost və düşmən məsələlrinə ehtiyac olardı. ***Həmçinin*** - Yaxşılığı əmr edib, pislikdən çəkindirməyə, səbrə və nəfsələ cihada, Allahın razı olduğu bir şeyi etməyə, Tövbəyə və günahlardan məğfirət diləməyə, düşmənin hiylə və şərindən qorunmaq üçün edilən duaya ehtiyac olmazdı"[1604]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Hər bir xeyirin başı – Allahın iradə (istədiyi) ilə hər bir şeyin olmasını qulun biməsidir. Onun iradə etmədiyi isə heç vaxt baş verməyəcəkdir. Onda sənə aydın olacaq ki, hər bir xeyir – Allahdan bir rəhmətdir və buna görə Ona həmd edəcək və Onun qarşısında boyun əyərək bu nemərlərin bitməyəcəyinə ümüd edəcəkdir. Lakin hər bir Şərrin səbəbi - Allahın öz qulunu köməksiz buraxaraq onu cəzalandırmasıdır və buna görə də sən Ona yalvarırsan ki, səni bundan qorusun və səni yaxşı işləri görməkdə və pis işlərdən çəkinməkdə öz öhdəliyinə buraxmasın. Elm əhli həmfikirdilər ki, hər bir xeyirin əsasında Allahın quluna etdiyi kömək (dayaq) vardır. Lakin hər bir şərrin əsasında isə - Allahın qulunu köməksiz buraxması vardır. ***Həmçinin*** - Onlar həmfikirdilər ki, Allahdan kömək o, zaman gəlir ki, O səni öz-özünə həvalə etmirsə. Onunköməyindən məhrum olmaq isə - O səni yalnız buraxmasıdır"[1605].

---

[1603] Müslim, əl-Albani "Səhih Hədislər" 2/655,659.
[1604] "Şərh Əqidətul Təhaviyyə" s.252-254.
[1605] "Favaid" s. 141.

# QƏDƏRƏ İMANIN DÖRD MƏRTƏBƏSİ

Əhli Sünnə vəl Cəmaat deyirlər ki, qədərə iman ancaq dörd xüsus ilə tamamlanır. Bunlara da qədərin mərtəbələri və ya əsasları adı verilir. Bu xüsuslar qədər məsələsini başa düşməyin yoludur. Qədərə iman isə, bütün bu əsasları həyata keçirmədikcə tamam olmaz. Çünki bunların bir qismi digərinə bağlıdır. Bunların hamısını qəbul edən bir kimsənin qədərə imanı tamamlanır. Bunların birinə və ya digərinə inanmayan bir kimsənin imanında sarsıntılar meydana gəlir. ***«(Ya Rəsulum!) Məgər bilmirsənmi ki, Allah göydə və yerdə nə varsa, hamsını bilir? Həqiqətən bu** (lövhi-məhfuz deyilən) **bir kitabdadır. Şübhəsiz ki, bu Allah üçün asandır».*** *(əl-Həcc 70).*

**1.** Uca Allah olmuş, olacaq hər bir şeyi təfsilatı ilə və incəliyinə qədər bildiyinə iman etmək. O, qullarının nələr etdiyini onları yarat-mamışdan əvvəl bildiyi kimi, onların ruzilərini, əcəllərini, sözlərini, əməllərini, bütün hərəkətlərini, gizlətdiklərini, üzə vurduqlarını, kimilərin Cənnət əhli, kimilərinin də Cəhənnəm əhli olduğunu, kimilərinin xoşbəxt və ya bədbəxt olduğunu da əzəldən bəri bilir. İmran b. Hüseyn - *radıyallahu anhu* – rəvayət edir ki: «Bir nəfər Ya Rəsulullah! Cənnət əhli ataş əhlindən (ayırd edilib) bilindi mi?» deyə soruşdu. Peyğəmbər: «Bəli, (ayırd edilib bilinmişdir) deyə buyurdu. Həmən şəxs: «Elə isə (yəni Cənnətlik, Cəhənnəmlik əzəldən bəri bəlli olduğu halda) çalışıb əməl edənlər nəyə əməl edirlər?» dedi. Peyğəmbər: «Hər kəs nə üçün yaradıl-mışsa onun yolları onun üçün asantlaşdırılacaqdır» deyə buyurdu[1606]. Hər bir kəs onun təyin etdiyi əcəl ilə dünyasını dəyişəcəkdir. Allahın təyin etdiyi əcəli isə keçə bilən və ya ondan geri qala bilən heç bir şey yoxdur. ***«Hər bir ümmətin** (əzəldən müəyyən edilmiş) **əcəl vaxtı vardır. Onların əcəli gəlib çatdıqda bircə saat belə nə yubanır, nə də tələsərlər».*** *(əl-Əraf 34).* ***«Biz heç bir məmləkəti əcəli gəlib çatmamış məhv etmədik. Heç bir ümmət əcəlini nə qabağa çəkə bilər, nə də yubandıra bilər».*** *(əl-Hicr 4,5).*

Allah hər bir şeyi yaratmazdan əvvəl bildiyi kimi, hal-hazırda da hər şeyi bilməkdədir. ***«Qeybin açarları Allahın yanındadır. Onları ancaq Allah bilir. Allah suda və quruda nə varsa bilir. Elə bir düşən yarpaq yoxdur ki, Allah onu bilməsin. Yerin zülmətləri içində elə bir şey yoxdur ki, məhz açıq-aydın kitabda olmasın».*** *(əl-Ənam 59).* ***«O, özündən başqa heç bir ilah olmayan, gizlini də, aşkarı da bilən Allahdır. O, rəhimli və mərhəmətlidir».*** *(əl-Həşr 22).* O, iman əhlini, şirk və küfr əhlini, salehləri, talehləri (saleh olmayanları) hər şeyi yaratmazdan əvvəl bilirdi. ***«Həqiqətən sənin Rəbbin öz yolundan çıxanları da, doğru yolda olanları da ən gözəl tanıyandır».*** *(Nun 7).*

Hansı gün, vaxt və harada onların başına nə gələcəyini də bilir. Yaratdıqlarından heç bir şey ondan gizli qalmaz. ***«…Heç kəs səhər nə əldə edəcəyini** (savab və ya günah qazanacağını)**, heç kəs harda öləcəyini bilməz. Allah isə şübhəsiz ki,** (hər şeyi) **biləndir və** (hər şeydən) **xəbərdardır».*** *(Loğman 34).* Əli - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizdən heç bir kimsə və yaradılmışlardan heç bir nəfs müstəsna olmaq üzərə şübhəsiz ki, Cənnətdəki və Cəhənnəmdəki yerini Allah yazmış (təqdir və təyin) etmişdir. Hər kəsin xoşbəxt və ya bədbəxt olduğu şübhəsiz ki, yazılmış-dır». Səhabələrdən biri: «Ya Rəsulallah! O, halda nə üçün əməl edib çalışırıq? Hər şey bilindiyi halda (əməlin faydası nədir?) dedi. Peyğəmbər: «Xoşbəxt olanlardan olan kimsə, xoşbəxt kimsələrin əməli ilə əməl

---

[1606] Buxari, Müslim.

edəcəkdir. Bədbəxt olanlar da, bədbəxt olan kimsələrin əməli ilə əməl edəcəkdir. Xeyr, siz o bilinmiş olan yazıya görə dayanmayın, əməl edib çalışın. Çünki hər kəs nə üçün yaradılıbsa o da onun üçün asantlaşdırıla-caqdır. Xoşbəxt olan kimsələrə, xoşbəxt kimsələrin əməllərini etmək asantlaşdırılacaqdır. Bədbəxt olan kimsələrə də, bədbəxt olan kimsələrin əməlini etmək asantlaşdırılacaqdır». Sonra bu ayəni oxudu: ***«Kim*** *(malını Allah yolunda)* ***versə,*** *(Allahdan)* ***qorxsa və ən gözəl sözü təsdiq etsə biz ona Cənnəti müyəssər edəcəyik. Amma kim*** *(malını Allah yolunda xərcləməyə)* ***xəsislik etsə,*** *(mal-dövlətinə güvənib Allaha)* ***möhtac olmadığını sansa və ən gözəl sözü yalan saysa biz onu Cəhənnəm üçün hazırlayacağıq»*** *(əl-Leyl 5-10)* .

**2.** Bu da Uca Allahın məxluqatın qədəri ilə əlaqədər olaraq əzəldən bildiyini Lövhi-Məhfuzda yazmış olduğuna iman etməkdir. Lövhi-Məhfuz isə hər bir şeyin qədəri yazılmış kitabdır. Meydana gəlmiş, gələcək və qiyamət gününə qədər olacaq hər şey Uca Allahın dərgahında Ummul Kitabda yazılmışdır. Buna həmçinin əz-Zikr, əl-Kitabul Mubin adları da verilmişdir. ***«Biz hər şeyi hesaba alıb İmami Mubində yazmışıq».*** *(Yəsin 12).* ***«Allah sizi*** *(atanız Adəmi)* ***torpaqdan, sonra nütfə-dən xəlq etmiş, sonra da sizi*** *(kişi və qadın olmaqla)* ***cüt-cüt yaratmışdır. O, bilmədən heç bir qadın hamilə olmaz və bari-həmlini yerə qoymaz. Ömür sahibi olan birinin uzun ömür sürməsi də, onun ömrünün qısaldıl-ması da ancaq kitabda*** *(Lövhi-Məhfuzda)* ***yazılmışdır. Həqiqətən bu Allah üçün çox asandır».*** *(Fatir 11).*

Bu mərtəbə bir neçə yerə bölünür.

**1) *Əzəli Qədər***

***«Yer üzündə baş verən və sizin öz başınıza gələn elə bir müsibət yoxdur ki, biz onu yaratmamışdan əvvəl o, bir kitabda*** *(Lövhi-Məhfuzda)* ***yazılmış olmasın. Bu Allah üçün çox asandır».*** *(əl-Hədid 22).* Abdullah b. Amr b. əl-As - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah məxluqatın (qəza və qədərini) göyləri və yeri yaratmamışdan əlli min il əvvəl yazmışdır. Ərşi də suyun üzərində idi» . Ubadə b. Samit - *radıyallahu anhu* – dan soruşurlar ki: "Ey Allahın Rəsulunun səhabəsi! Atan ölümündən qabaq sənə hansı vəsiyyəti edib". Atam məni yanına çağıraraq dedi: "Oğlum! Allahdan qorx və bil ki, Ona iman etmədikcə, xeyir və şərrin qədərdən olduğuna iman etmədikcə ondan qorxmazsan. Bu şeylərə iman etmədən ölsən atəşə düşərsən. Mən Rəsulullah – *sallallahu aleyhi və səlləm* – belə buyurduğunu eşitdim: «Heç şübhəsiz ki, Allahın ilk yaratdığı şey qələmdir». Ona: «Yaz!» deyə buyurdu. Qələm: «Ya Rəbbim! Nə yazım» dedi. Allah: «Qiyamətin qopacağı vaxta qədər hər bir şeyin qədərini yaz!» deyə buyurdu .

**2) *Ömürlük Qədər***

***«****(Ey Peyğəmbər!)* ***Xatırla ki, bir zaman Rəbbin Adəm oğullarının bellərindən*** *(gələcək)* ***nəsillərini çıxardıb onları özlərinə*** *(bir-birinə)* ***şahid tutaraq: «Mən sizin Rəbbiniz deyiləmmi?» soruşmuş, onlar da: «Bəli, Rəbbimizsən!» deyə cavab vermişdilər.*** *(Belə bir şahidliyin səbəbi)* ***Qiyamət günü: «Biz bundan qafil idik».*** *(əl-Əraf 172).* İshaq b. Rahuyenin rəvayət etdiyinə görə bir nəfər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən Qəza və Qədər haqqında soruşur. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Uca Allah Adəmin belindən zurruyətini çıxardıb onları özlərinə

[1607] Buxari, Müslim.
[1608] Müslim.
[1609] Tirmizi 2155, Əbu Davud 4/225,226, Musnəd 5/317, əl-Albani "Səhih" 2\228.

qarşı şahit tutduqdan sonra ovcu ilə onları götürdü. Bunlar Cənnətlik, bunlar Cəhənnəmlikdir deyə buyurdu. Cənnət əhli olanlara Cənnət əhlinin əməli asantlaşdırıldı, Cəhənnəm əhli olanlara da Cəhənnəm əhlinin əməlləri asantlaşdırıldı» . İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah Adəmin belindən Numanda (Ərafətdə) əhd almışdır. Onun belindən yaradacağı bütün zurriyətini çıxardaraq sanki qarşısına kiçik qarışqalar kimi səpmişdir. Sonra onlarla danışaraq: ***«(Ey Peyğəmbərim!) Xatırla ki, bir zaman Rəbbin Adəm oğullarının bellərindən** (gələcək) **nəsillərini çıxardıb onların özlərinə** (bir-birinə) **şahid tutaraq: "Mən sizin Rəbbiniz deyiləmmi?" – soruşmuş, onlar da: "Bəli, Rəbbimizsən!" – deyə cavab vermişdilər.** (Belə bir şahidliyin səbəbi) **Qiyamət günü: "Biz bundan qafil idik».*** *(əl-Əraf 172)* . Əbu Darda - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah Adəmi xəlq etdikdən sonra, onun sağ çiyninə vuraraq kiçik qarışqalar şəkilində oradan onun ağ zurriyətini çıxartdı. Sonra onun sol çiyninə vuraraq kömürə oxşar qara zurriyətini çıxardı. Sonra sağ əlində olanlara: Cənnətə və Mənə fərq etməz, sol əlində olanlar: Cəhənnəmə və Mənə fərq etməz"[1612]. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Güc və Qüvvət sahibi olan Allah məxluqatını zülmətdə xəlq etdi və onların üzərində Öz nurundan verdi. Kimin üzərinə nur düşmüşsə onlar doğru yolla gedənlərdi. Kimin də üzərinə nur düşməmişsə o, kimsə zəlalətdə olandır. Buna görə də mən deyirəm ki: Artıq qələm qurumuş və Allah hər bir şeydən xəbərdardır"[1613]. Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – Ənsarlardan balaca bir uşağın cənazəsinə çağrıldı. Mən: «Ya Rəsulullah! O, nə xoşbəxdir! O, Cənnət sərçələrindən bir sərçə quşudur. Pislik etmədi və pislik etmək yaşına da çatmadı[1614]» dedim. Peyğəmbər: «Məgər bilmirsən Allah Cənnət üçün bir

---

[1610] İbn Qeyyim «Şifaul Alil» s. 10, İbn Cərir «Təfsir» Əhməd Şakirin təhqiqi ilə 13/244-250, Əbu Davud 4/224.

[1611] İmam Əhməd «Musnəd» 1/172, İbn Əbi Asim «əs-Sünnə» 202, İbn Cərir «Təfsir», əl-Albani «Səhih Hədislər Silsiləsi» 1623, "Mişkət" 1/43.

[1612] Xatib Təbrizi "Mişkət" 1/42.

[1613] Tirmizi 2642, əl-Albani "Səhih".

[1614] İbn Teymiyyə – *rahmətullahi aleyhi* – müşriklərin uşaqlarından danışarkən deyir ki: "Allah onların nə edəcəklərini daha gözəl bilir – Həddi-buluğa çatdıqları zaman Onlardan kimin kafir, kimin isə mömin olduğunu Allah daha gözəl bilir. Əbu Hureyrə - *radıyallahu anhu* – Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Qiyamət günü Allah onların cəm olduqları yerə bir Peyğəmbər göndərəcəkdir. Kim ona tabe olacaqsa Cənnətə, kim də asilik edəcəksə Cəhənnəmə girəcəkdir. Bu zaman Allahın onlar barəsində bildiyi həyata keçəcəkdir. Əməllərinin qarşılığı onlara veriləcəkdir". Məcmuul Fətava 4/246. ***Ölmüş Körpə Uşaqlar Haqqında Bir Cox Rəylər Var:*** **1)** Onlar Allahın istəyi altındadırlar. **2)** Onlar hamısı Cənnətlikdirlə**r. 3)** Ataları haraya düşəcəksə onlar da oraya düşəcəklər. Valideyinlərinə tabe olurlar. Valideyinlərindən biri Cənnətə girərsə Cənnətə, Cəhənnəmə girərsə Cəhənnəmə girərlər. Aişə - *radıyallahu anhə* – deyir ki, peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən: "Müşriklərin kiçik ikən ölən uşaqlarının axirətdə halı necə olacaqdır?". O: "Atalarına tabe olurlar". Heç bir əməl etmədən necə atalarına tabe olurlar. O: "Onların nə əməl etdiklərini Allah bilir" deyə buyurdu. Əbu Davud. **4)** Torpağa çevriləcəklər. **5)** Cənnət ilə Cəhənnəm arasında bir yerdə olacaqlar. **6)** Müşriklərin uşaqları Cənnət əhlinə xidmət edəcəkdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Rəbbimdən kiçik ikən ölən müşrik uşaqlarının Cənnətdə möminlərə xidmət etmələrini istədim. Rəbbim də qəbul etdi". Həkim, Tirmizi. **7)** Bu məsələni araşdıranda susmaq lazımdır. **8)** Araşdırmamış susmaq lazımdır. **9)** Hamısı Cəhənnəmdədir. **10)** Allah onları imtanhan edəcəkdir. Ən doğru olanı **1**-ci və **10**-cu rəylərdir. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər doğulan təbiətinə görə (fitrət üzərə) doğular. Sonradan ata-anası onu Yəhudiləşdirər, Xristianlaşdırar, Atəşpərəstləşdirər. Həqiqətən heyvalarda dünyaya sağ-salamat gəlirlər. Məgər sən onların içərisində kəsik qulaqlı doğulan görmüsən. ***«(Ya Muhəmməd! Ümmətinlə birlikdə)* batildən haqqa tapınaraq üzünü Allahın fitri olaraq insanlara verdiyi dinə (İslama) tərəf tut. Allahın dinini heç vəchlə dəyişdirmək olmaz. Doğru din budur, lakin insanların əksəruiyyəti bilməz».** *(ər-Rum 30)* (Başqa rəvayətdə: Bir nəfər: «Ya Rəsulullah! Əgər uşaq Yəhudi, nəsrani və Məcusi olmamışdan qabaq ölərsə nə deyirsə?». Peyğəmbər: «Allah onların nə edəcəklərini daha yaxşı biləndir)». Müslim 2658. Bu hədisdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurmadı ki: "Müsəlmanlaşdırar". Çünki hər doğulanın doğulduğu təbiəti İslamdır. Ayə: Allah qullarını Həniflər olaraq yaratdı və doğru olanı qəbul etmək üçün onlara fərasət vermişdir. Lakin sonradan

əhali yaratdı ki, onlar atalarının bellərində ikən Allah onları Cənnət üçün yaratmışdır. Allah Cəhənnəm üçün elə bir əhali yaratmışdır ki, onlar atalarının bellərində ikən Allah onları Cəhənnəm üçün yaratmışdır» deyə buyurdu . Müslim b. Yəsar rəvayət edir ki, Ömər - *radıyallahu anhu* – dan bu ayə barəsində soruşdular: ***«****(Ey Peyğəmbərim!)* ***Xatırla ki, bir zaman Rəbbin Adəm oğullarının bellərindən*** *(gələcək)* ***nəsillərini çıxardıb onların özlərinə*** *(bir-birinə)* ***şahid tutaraq: "Mən sizin Rəbbiniz deyiləmmi?" – soruşmuş, onlar da: "Bəli, Rəbbimizsən!" – deyə cavab vermişdilər.*** *(Belə bir şahidliyin səbəbi)* ***Qiyamət günü: "Biz bundan qafil idik».*** *(əl-Əraf 172).* Ömər - *radıyallahu anhu* – Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in belə buyurduğunu rəvayət etdi: "Həqiqətən Allah Adəmi xəlq etdikdə sağ əli ilə onun belinə apararaq oradan zurriyətini çıxardaraq buyurdu: Mən bunları Cənnət üçün yaratdım və onlar Cənnət əhlinin əməllərini edəcəklər. Sonra yenə də əlini onun belinə apararaq oradan zurriyətini çıxardaraq buyurdu: Bunları isə Mən Cəhənnəm üçün yaratdım və onlar Cəhənəəmə əhlinin əməllərini edəcəklər". Bu zaman bir nəfər: "Bəs onda əməl nəyə gərəkdir?" deyə soruşdu. Peyğəmbər: "Əgər Allah bəndəsini Cənnət üçün yaradıbsa ona Cənnət əhlinin əməllərini etməyə yardım edər (imkan verər), o da bu əməllərdən biri üzərə ölər və Cənnətə düşər. Yox əgər Allah onu Cəhənnəm üçün yaratmışsa ona Cəhənnəm əhlinin əməlini etməyə imkan verər, o da bu əməllərdən biri üzərə ölər və Cəhənnəmə düşər. (Bizim bundan xəbərimiz yoxdur deməyəsiniz deyə Allah Adəm oğullarının belindən zurriyətini çıxardıb və onları özlərinə şahid tutmuşdur)» .

**3)** ***Ana Bətnində Yazılan Qədər***

Əbu AbdurRahmən Abdulla b. Məsud – *radıyallahu anhu* – rəvayət edir ki, doğru sözlü və doğru sözü təsdiq olunan Rəsulullah - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizdən hər birinizin yaradılışı onun anasının qarnında qırx gün nütfə şəklində olaraq bir yerə gətirilir. Sonra bu müddət qədər aləqa şəklində olur. Sonra yenə bu müddət qədər mudğa şəklində olur. Sonra ona bir mələk göndərilir, mələk ona ruh üflədikdən sonra dörd xüsusiyəti yazmaqla əmr olunur. Ruzisini, əcəlini, əməlini, bədbəxt və ya xoşbəxt olacağını» . Lövhi Məhfuza baş verəcək hər bir şey qeyd olunmuşdur. Lakin həyat ruzisi və əcəl Mələklərin (Lövhi Məhfuzdan götürülmüş) kitabında qeyd olunmuşdur. Bu da müəyyən səbəblərə görə dəyişə bilər. İnsanın iki həyatı (əcəli) vardır. 1) Son – qəti olaraq yalnız Allaha məlumdur. 2) Son olmayan – Allah Mələklərə bəndənin ruzisini və yaşını qeyd etmələrini əmr edir. Əgər bəndə

---

şeytanlar onları azdırdılar. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Rəbbindən buyurduğu rəvayətdə: «Mən qullarımı Həniflər olaraq yaratdım. Lakin sonradan şeytanlar onları dinlərindən sağa-sola sürüklədilər. Onlara halal etdiyimi qadağan etdilər və haqqında heç bir dəlil nazil etmədiyim şeyləri Mənə şərik qoşmağı əmr etdilər». Buxari, Müslim. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü bağışlanmış olduqlarını iddia edərək dəlil gətirəcək dörd təbəqədən olan insanlar vardır. Qulağı eşitməyən kar, axmaq adam, yaşlı adam və fitrət zamanı ölən insanlar. Kar belə deyər: «Ey Rəbbim, İslam gəldi lakin mən heç bir şey eşitmədim». Axmaq isə: «Ey Allahım, İslam gəldi lakin balaca uşaqlar belə məni ələ salıb başıma dəvə təzəyi atırdılar». Yaşlı dedi: «İslam gəldi, lakin mən heç bir şey başa düşmürdüm». Fitrət zamanı ölən insanlara gəlincə isə: «Ey Rəbbimiz, sənin elçilərin olan Peyğəmbərlər bizə gəlmədilər». Uca Allah Ona itaət etmələri barədə onlara əhd edir. Oda girin – hökmünü onlara təbliğ etmək üçün onlara bir Peyğəmbər göndərir. Peyğəmbər: «Nəfsim əlində olan Allaha and içirəm ki, əgər onlar oda girsəydilər bu onlar üçün sərinlik və salamatlıq olardı". Təbərani 841, İbn Hibban 1827, Əhməd 4/24, əl-Albani 1434.

[1615] Buxari, Müslim 2662.

[1616] Muvatta 3/92, Tirmizi 5/266, Əbu Davud 4/227, Musnəd 1/44,45, əl-Albani "Mişkət" 95, "Səhih".

[1617] ***Nütfə*** – məni mənasındadır. Nütfə bəzən də saf su adlanır.

[1618] ***Aləqa*** – laxtalanmış qan, ziyil deməkdir. ***«O, insanı laxtalanmış qandan yaratdı»****. (əl-Ələq 2).*

[1619] ***Mudğa*** – çeynənilmiş ət parçasına oxşadığı üçün bu ad verilmişdir.

[1620] Fəthul Bəri 11/477, Müslim 2643.

qohumluq əlaqələrini möhkəmlədərsə bu zaman (Allah əmr edər ki) onun ruzisi artsın və ömrü də uzansın. Əgər o, əlaqələri kəsərsə ruzisi və ömrü də qısalar. Bəndənin ömrünün artıb-artmamasından isə mələyin xəbəri olmur. Allah isə hər bir şeydə xəbərdardır"[1621].

**3)** ***Qədr Gecəsində Yazılan İllik Qədər***

***«Hər bir hikmətli*** *(yaxud dəyişilməsi mümkün olmayan)* ***iş o, gecə hökm*** *(ayırd)* ***olunur. Dərgahımızdan bir buyuruq olaraq!*** *(İl ərzində birinin başına gələcək bütün işlər, dünyada baş verəcək bütün hadisələr, xeyr, şər, əcəl, ruzi, xoşbəxtlik, bədbəxtlik və s. Lövhi-Məhfuzda həmən ilin məhz qədir gecəsi yazılır və müvəkkil mələklərə bildirilir. Bu yazıya pozu yoxdur)* ***Həqiqətən Peyğəmbərləri biz göndəririk».*** *(əd-Duxan 4).* İbn Abbas - *radıyallahu anhu –* deyir ki: «Qədr gecəsində ana kitabdan bir il boyunca meydana gələcək ölüm, həyat, ruzi, yağış və hətta həcc edilən belə yazılır. Filan kişi həcc etdi, filan kişi həcc etdi».

**4)** ***Gündəlik Qədər***

***«Göylərdə və yerdə kim varsa, hamısı ondan*** *(ruzi, mərhəmət və mədəd)* ***diləyir. O, hər gün*** *(hər an)* ***bir işdədir.*** *(Birini öldürər, birini dirildər, zalimə zülm edər, acizə kömək, birinin duasını qəbul edər, birinə mərhəmət əta edər, digərinə cəza verər. Bir işlə məşğul olmaq onu digərindən yayındırmaz)».* *(ər-Rəhman 29).* İbn Abbas - *radıyallahu anhu –*deyir ki, şübhəsiz Allahın yaratdıqları içərsində ağ incidən Lövhi-Məhfuz da vardır. Onun hər iki qapağı qırmızı bir yaqutdandır. Qələmi nurdur, yazısı da nurdur. Hər gün ona üç yüz altımış dəfə baxar. Bu baxışların hər birində yaradır, ruzi verir, həyat verir, öldürür, rəhm edər, zəlil edər və hər nə diləyərsə onu da edər və bu ayəni oxudu: ***«O, hər gün*** *(hər an)* ***bir işdədir».*** *(ər-Rəhman 29)* .

**3.** Yəni bu kainatda meydana gələn hər bir şey rəhmət və hikmətlə Allahın iradəsi və qüdrəti ilə meydana gəlir. Kainatda Allahın diləməsi olmadan heç bir şey vücuda gəlməz. O, dilədiyini rəhməti ilə hidayətə yönəldir, dilədiyini hikməti ilə sapdırır. ***«Allah iman gətirənləri dünyada da, axirətdə də möhkəm bir sözlə*** *(şəhadətlə)* ***sabitqədəm edər. Allah zalimləri*** *(haqq yoldan)* ***sapdırar. Allah istədiyini edəndir».*** *(İbrahim 27).* ***«Əgər Allah istəsəydi sizi*** *(eyni dində olan)* ***tək bir ümmət edərdi. Allah dilədiyini yoldan çıxardar, dilədiyini isə doğru yola salar. Sözsüz ki, etdiyiniz əməllərə görə sorğu-sual olunacaqsınız».*** *(ən-Nəhl 93).* ***«Rəbbin istədiyini yaradar və seçər. Onların heç bir ixtiyarı yoxdur».*** *(əl-Qəsəs 68).* ***«Allah istədiyini*** *(haqq yoldan)* ***azdırar, istədiyini isə düz yola yönəldər».*** *(əl-Ənam 39).* ***«****(Ya Muhəmməd!)* ***Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən. Amma Allah istədiyini doğru yola salar. Doğru yolda olacaq kəsləri daha yaxşı o, bilir».*** *(əl-Qəsəs 56).* Dilədiyi hər bir şey qaçınılmaz olaraq onun qüdrəti ilə olur. Olmaması mümkün deyildir. Olmasını diləmədiyi isə olmaz. ***«Bir şeyi yaratmaq istədiyi zaman Allahın buyurduğu ona ancaq: «Ol!» deməkdir. O, da dərhal olar.*** *(Yasin 82).* ***"Allah istəsəydi, onları yığıb doğru yola salardı".*** *(əl-Ənam 35).* ***"Əgər Allah istəsəydi, onlar müşrik olmazdılar. Biz səni onların üzərində gözətçi qoymamışıq və sən onların vəkili də deyilsən!".*** *(əl-Ənam 107).* ***"Əgər Rəbbin istəsəydi, yer üzündə olanların hamısı iman gətirərdi. İnsanları iman gətirməyə sənmi məcbur edəcəksən?!*** *(Bu sənin işin deyildir. Sənin vəzifən ancaq islamı təbliğ etməkdir)".* *(Yunus 99).* ***"Məgər Rəbbinin kölgəni*** *(günçıxandan günbatanadək)* ***necə uzatdığını görmürsənmi? Əgər istəsəydi, onu daim***

---

[1621] Məcmuul Fətava 8/517,540.

[1622] əl-Həkim «Mustədrək» 2/519.

***öz yerində saxlayardı. Sonra Biz günəşi*** *(kölgəyə)* ***bir əlamət etdik.*** *(Əgər günəş olmasaydı, kölgə bilinməzdi).* ***Sonra onu*** *(o kölgəni günəşin yüksəlməsi ilə)* ***yavaş-yavaş Özümüzə tərəf çəkdik.*** *(Əgər kölgəni yerə birdən salıb, birdən çəksəydik, insanlar vahiməyə düşərdilər)". (Furqan 45-46).* ***"Əgər Allah istədiyi, sizi*** *(eyni şəriətə tabe)* ***vahid bir ümmət edərdi. Lakin bu*** *(müxtəliflik)* ***Allahın verdikləri ilə sizi imtahan etməsi üçündür. Elə isə yaxşı işlər görməkdə bir-birinizi ötməyə çalışın*** *(bir-birinizlə yarışın)**. Hamınızın axır dönüşü Allahadır.*** *(Allah)* ***aranızda ixtilaf doğuran məsələlər barəsində sizə xəbər verəcəkdir!".*** *(əl-Maiidə 48).* Qurani Kərimdə bu cür ayələr çoxdur. Əgər bir şey baş vermirsə bu o, demək deyil ki, Allah buna qadir olmadı. Əsla, Allah bunu belə istəyir. Allah hər bir şeyə qadirdi.

O, qulları üçün nəyi dilərsə o, da olur. Nəyi də diləməzsə, insanların hamsı bunun olmasını diləsələr də belə onun olması mümkün deyildir. ***«Əgər Allah sənə bir zərər yetirsə, səni ondan Allahdan başqa heç kəs qurtara bilməz. Əgər Allah sənə bir xeyr diləsə, heç kəs onun nemətinə maneçilik edə bilməz. Allah onu bəndələrindən istədiyinə nəsib edər. O, bağışlayan və rəhm edəndir».*** *(Yunus 107). «(Ey insanlar! Onu da bilin ki)* ***Allah istəməsə, siz*** *(bunu)* ***istəyə bilməzsiniz. Həqiqətən Allah*** *(hər şeyi)* ***biləndir, hikmət sahibidir».*** *(Dəhr 30).* ***«Eləcə də sizdən doğru-düz*** *(yolda)* ***olmaq istəyənlər üçün.*** *(Onu da bilin ki)* ***aləmlərin Rəbbi olan Allah istəməsə, siz*** *(bunu)* ***istəyə bilməzsiniz».*** *(ət-Təkvir 28-29).* İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – mənə bir neçə nəsihət verərək buyurdu: «…Bunu da bil ki, əğər bütün insanlar sənə xeyir vermək üçün bir yerə yığışsalar Allahın yazdığından artıq sənə heç bir xeyir verə bilməzlər. Bunu da bil ki, əğər sənə zərər vermək üçün bir yerə yığışsalar yenə də Allahın yazdığından artıq sənə zərər verə bilməzlər. (Çünkü) qələmlər qaldırılmış, səhifələr (in mürəkkəbi) qurumuşdur»[1623]. ***«Allahın insanlara əta etdiyi mərhəmətə*** *(verdiyi nemətə, ruziyə)* ***heç kəs mane ola bilməz. Onun vermədiyi bir şeyi də özündən başqa heç kəs göndərə bilməz. O, yenilməz qüvvət və hikmət sahibidir».*** *(Fatir 2).* ***«O, istədiyini edəndir».*** *(əl-Buruc 16).* Abdullah b. Amr b. əl-As - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Adəm oğullarını qəlbləri Rəhmanın barmaqlarından iki barmağı arasında bir tək qəlb kimidir. Rəhman onları dilədiyi (istədiyi) yerə çevirib döndərir»[1624]. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Uca Allah istədiyi vaxt ruhlarmızı aldı və istədiyi vaxt onları geri qaytardı»[1625]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «…Allah istəsə və filan kişi istəsə deməyin. Yalnız Allah istəsə deyin»[1626]. O, etdiyi heç bir şeydən soruşulmaz, yaratdıqları isə soruşulurlar. Heç bir şey onun istədiyindən kənara çıxa bilməz. ***«Allah gördüyü işlər barəsində sorğu-sual olunmaz. Onlar*** *(bütün bəndələr)* ***isə sorğu-sual ediləcəklər».*** *(əl-Ənbiya 23).* ***«…Əgər Allah istəsəydi, bu peyğəmbərlərin ardınca gələn insanlar onlara göndərilən aşkar dəlillərdən sonra bir-birləri ilə vuruşmazdılar. Fəqət*** *(bununla belə yenə də)* ***ixtilafa düşdülər. Onlardan bəziləri Allaha iman gətirdilər, bəziləri isə kafir oldular. Əgər Allah istəsə idi, onlar bir-birləri ilə vuruşmaz-dılar. Lakin Allah öz istədiyini edəndir».*** *(əl-Bəqərə 253).* ***«Anaların bətnində sizə istədiyi surəti verən odur. O, qüdrət və hikmət***

---

[1623] Tirmizi 2516, əl-Albani «Səhih əl-Cəmi» 7834-cü hədis.
[1624] Müslim.
[1625] Buxari, Müslim.
[1626] Əbu Davud 4/295, Musnəd 5/384,394,398.

***sahibindən başqa heç bir ilah yoxdur».*** *(Ali İmran 6).* ***«Beləcə biz hər bir Peyğəmbər üçün insan və cin şeytanlardan düşmənlər yaratdıq. Onlar aldatmaq məqsədilə bir-birinə təmtəraqlı sözlər təlqin edərlər. Əgər Rəbbin istəsəydi onlar bunu etməzdilər. Onları uydurduqları yalanlarla boşla getsin».*** *(əl-Ənam 112).*

**4.** Uca Allah hər şeyin yaradıcısı olduğuna, göylərdə və yerdə onlar arasında olan hər şeyi onun yaratdığına inanmaqdır. Ondan başqa bir yaradıcı, ondan başqa Rəbb yoxdur. Ondan başqa hər nə varsa yaradıl-mışdır. O, əməldə olan hər kəsi və onun əməlini, hərəkət edən hər bir varlığı və hərəkətini yaradandır. ***«Halbuki sizi də, sizin düzəltdiklərinizi də Allah yaratmışdır».*** *(əs-Saffat 96).* ***«And olsun nəfsi*** *(insanı və ya insan nəfsini)* ***yaradana».*** *(əş-Şəms 7).* ***«Sizi*** *(yoxdan)* ***yaradan, sonra sizə ruzi verən, sizi öldürən və daha sonra*** *(qiyamət günü)* ***dirildən məhz Allahdır».*** *(ər-Rum 40).* ***«Bu*** *(gördükləriniz)* ***Allahın yaratdıqlarıdır. İndi siz də mənə Allahdan başqalarının nə yaratdığını göstərin. Xeyr, zalimlər açıq-aşkar əyri yoldadırlar».*** *(Loğman 11).* ***«…Lakin Allah imanı sizə sevdirmiş, onu ürəklərnizdə süsləmiş, küfrə, itaətdən çıxmağa və*** *(Allaha)* ***asi olmağa qarşı sizdə nifrət oyatmışdır….».*** *(əl-Hucurat 7).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şübhəsiz Allah bir işi edəni və onun etdiyi işi yaradandır»[1627].

Açıqladığımız şəkildə qədərə iman etmək, qulun ixtiyar sahibi olmasına (yəni pis və yaxşını seçməsinə) və bu əməlləri etməsinə yetəcək qədər güc və qüvvəti olmasına zidd deyildir. ***«Allahdan*** *(Allahın əzabın-dan)* ***bacardığınız qədər qorxun».*** *(ət-Təğabun 16).* ***«Qadınlar sizin tarlanızdır. İstədiyiniz vaxtda öz tarlanıza gəlin. Özünüz üçün qabaq-cadan yaxşı əməllər hazırlayın».*** *(əl-Bəqərə 223).* ***«Allah heç kəsi qüvvəsi çatmayan işi*** *(görməyə)* ***vadar etməz. Hər kəsin qazandığı yaxşı əməl də, pis əməl də özünə aiddir».*** *(əl-Bəqərə 286).*

Qədərə iman gətirmək kamil olmaz ta ki, insan bu dörd şeyə iman gətirmədikcə.

## QƏDƏRİ DƏLİL GƏTİRMƏK

Buna görə də qulun fərzləri tərk edib, pis işləri görməklə qədəri dəlil gətirməsi doğru deyildir.

**1)** Allah əzəli elmi ilə Adəm oğullarının Cənnətə və Cəhənnəmə girəcək olanların hamsını bilir. Bunların saylarında artma və əskilmədə olmaz. Allah hər insanın ana bətnində ikən iman əhli mi, yoxsa küfr əhli mi olduğunu bilir. Bu Lövhi Məhfuzda da yazılmışdır. Allahın bu haqda elmi əsla dəyişməz.

Yenə də quların əməlləri onlar o, əməlləri etməzdən əvvəl də Allaha bəllidir. Bu Allahın əzəli bir elmidir. Hər insan nə üçün yaradılmışsa ona uyğun əməl edər. Cənnət əhli Cənnət əhlinin əməlləri ilə əməl edər, Cəhənnəm əhli Cəhənnəm əhlinin əməlini işləyənlərdir. Bir kimsə pis əməldən sonra saleh əməl etmək yazılmışsa o, etdiyi pis əməldən sonra Cənnətə girər. Bəzi kimsələr də vardır ki, daha əvvəl saleh əməl işlədiyi halda həyatı Cəhənnəm əhlinin əməli ilə bitər və Cəhənnəm əhli olaraq yazılar. Mühüm olan insanın son anda etdiyi əməldir. Mömin ancaq Allahın diləməsi ilə mömindir, kafir də uca Allahın diləməsi ilə kafirdir. Səhl b. Sad - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnsanlar arasında elə kimsələr də vardır ki, insanlara görnüşünə (əməllərinə) görə Cənnət əhlinə yaraşan xeyrli əməllər edər. Halbuki o, Cəhənnəmlikdir. Yenə insanlardan elələri də vardır ki,

---

[1627] Buxari «Xalqu Əfalul İbad» s. 25, Beyhəqi «Əsməu və Sifət» s. 23.

insanlara görnüşünə (əməllərinə) görə Cəhənnəmliklərə aid pis əməllər edər. Halbuki o, Cənnətlikdir» . Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Əgər Allah bir quluna xeyir diləyərsə onu istəfadə edər". Biz: "Necə istifadə edər? Ya Rəsulullah" dedik. Peyğəmbər: "Ölüm anında ona saleh əməl etməyə yardımçı olar" deyə buyurdu[1629]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həqiqətən elə bir kimsə vardır ki, uzun zaman Cənnət əhlinin əməlini edər. Lakin sonra onun bu əməli Cəhənnəm əhlinin əməli ilə son olub möhürlənər. Kimisi də uzun zaman Cəhənnəm əhlinin əməlini edər. Lakin sonra onun bu əməli Cənnət əhlinin əməli ilə son olub möhürlənər» . Səhl b. Sad – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – Xeybər günü müşrik Yəhudilərlə qarşılaşdı. Bu döyüşdə səhabələrin içindən olan bir nəfər mərdanə düşmənlərə qarşı vuruşurdu. Səhabələr: «Bu gün bizdən heç kimsə filankəsin göstərdiyi igidlik kimi igidlik göstərməyib» dedilər. Peyğəmbər: «O, Cəhənnəm-likdir» deyə buyurdu. Səhabələrdən biri onu izləməyə başladı. Nəhayət döyüş əsnasında o, kimsə ağır yaralandı və ağrıdan ölmək istəyən o, kimsə qılıncının iti ucunu qarnına arxa tərəfini isə yerə diriyərək üstünə sancıldı və öldü» . ***Müşriklər belə deyəcəklər: «Əgər Allah istəsəydı, nə biz, nə də atalarımız müşrik olar və nə də biz bir şeyi haram edə bilərdik. Onlardan əvvəlkilər də*** *(öz Peyğəmbərlərini)* ***belə təkzib etmişlər. Nəhayət əzabımızı daddılar». Onlara de ki: «Bizim qarşımıza çıxara biləcək bir elminiz varmı? Siz yalnız zənnə qapılır və yalan uydurur-sunuz».*** *(əl-Ənam 148).* Əgər qədər onların leyhinə dəlil təşkil etsəydı, Allah onlara əzabını daddırmazdı.

**2)** Allahın sapdırdığı kimsənin irəli sürəcək hər hansı bir dəlili və ya bir iddiası yoxdur. Çünki uca Allah irəli sürüləcək bir bəhanə qalmasın deyə Peyğəmbərlər göndərmiş və qulun əməlini ona başa salaraq bunu qulun qazandığı olaraq təqdir etmişdir. ***«Biz Peyğəmbərləri*** *(möminlərə)* ***müjdə gətirən və*** *(kafirləri)* ***əzabla qorxudan kimi göndərdik ki, daha insanlar üçün Peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın. Allah yenilməz qüvvət və hikmət sahibidir».*** *(ən-Nisa 165).* Əgər Peyğəmbərlərə itaət etməyənlərin leyhinə qədər dəlil təşkil etsəydi, peyğəmbərlərin göndərilməsi ilə bu dəlil ortadan qaldırılmamalıydı. Lakin əksinə Allah peyğəmbərlər göndərməklə onlara pisi və yaxşını (halal və haramı) açıqlamışdır. Haqq və batil bəyan edilmişdir. Onların isə qədəri dəlil göstərməkdə heç bir əsası yoxdur.

**3)** Uca Allah əmr və qadağalar vermiş və ancaq gücü çata bilən şeylərlə onu sorumlu etmişdi. ***«Allahdan*** *(Allahın əzabından)* ***bacardığı-nız qədər qorxun».*** *(ət-Təğabun 16).* ***«Allah heç kəsi qüvvəsi çatmayan işi*** *(görməyə)* ***vadar etməz. Hər kəsin qazandığı yaxşı əməl də, pis əməl də özünə aiddir».*** *(əl-Bəqərə 286).* Əgər qul əməllərini etməyə məcbur olsaydı, o halda gücü çatmayan və edilməsi mümkün olmayan şeylərlə sorumlu olmuş olardı. Belə bir şey isə batildir. Çünki qul bilmədən, unutqanlıqdan və ya məcburiyyət qarşısında qalaraq etdiyi günahlardan ötrü sorumlu olmayacaqdır. İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu*

---

[1628] Müslim 2651.
[1629] Tirmizi 2142, əl-Albani "Səhih".
[1630] Müslim 2651.
[1631] Buxari 6607, Müslim 112.

*aleyhi və səlləm* – buyurdu: «Allah mənə görə ümmətimin səhvən, unutqanlıqdan və məcburiyyət qarşısında qalaraq etdiyi günahlardan keçib» .

**4)** Uca Allahın qədəri gizli bir sirdir. Qulun onu bilməsi ancaq etdiyi əməlin meydana gəlməsindən sonra mümkün ola bilir. Qul həqiqi mənada faildir. Allah da onların feillərini (əməllərini) yaradandır. Qul mömin, kafir, yaxşı, günahkar, namaz qılan, oruc tutandır. O, halda iman və əməlləri yaradan da Allahdır. Qula öz əməllərini edə bilməsi üçün qüdrəti, iradəni və seçmi də vermişdir. Onların qüdrətini və iradəsini yaradan da Allahdır. Sonra da xeyr və şərri bir-birindən ayırd etmək üçün ağıl da vermişdir. ***«Eləcə də sizdən doğru-düz** (yolda) **olmaq istəyənlər üçün.** (Onu da bilin ki) **aləmlərin Rəbbi olan Allah istəməsə, siz** (bunu) **istəyə bilməzsiniz».** (ət-Təkvir 28-29).*

**5)** Bizlər insanların dünya işlərində özlərinə uyğun olan işlərə yönəldiklərini, onları əldə etməyə çalışdıqlarını, (xeyrli işləri) kənara qoyaraq uyğun olmayan (xeyri olmayan) işlərə yönəlmədiklərini, uyğun işlərə yönəldiklərinə görə də qədəri dəlil göstərmədiklərini görürük. Yaxşı, bəs nə üçün insan dini ilə əlaqəli xüsuslarda ona fayda verən şeyləri (halalı) buraxaraq zərərli (haram) şeylərə yönələrək qədəri dəlil göstərərək, mənim üçün belə yazılmışdır? Deyir. Hər iki işin durumu eyni deyildirmi? Bu məsələ ilə bağlı açıqlama verək. Bir kimsənin qarşısına iki yol çıxır. Bunlardan biri çətinliklərlə, əzab-əziyyətlərlə (ölüm, talan) qorxu və aclığın hökm sürdüyü bir ölkəyə aparır. Digər yol isə rahatlıq, əzab-əziyyət olmayan ədalətli bir ölkəyə aparır. İnsan bu iki yoldan hansını seçər? Əlbətdəki rahatlıq və ədalətli olan ölkəyə aparan yolu seçər. Heç vaxt ağlı başında olan adam birinci yolu seçib bununlada qədəri dəlil gətirməz. O, halda axirət ilə əlaqədar xüsuslarda nə üçün Cənnətə deyil məhz Cəhənnəmə götürən yolu izləməklə qədəri dəlil göstərməkdədir.

**6)** Fərzləri tərk etməklə, qadağaları etməklə qədəri dəlil göstərən bir kimsənin malını haqsızlıqla əlindən alsalar və ya ona qarşı haqsızlıq edilib və qədəri dəlil göstərən kimsəyə: «Məni qınama, çünki mənim sənə olan bu haqsızlığım Allahın qədəri ilədir». Onun belə bir iddiası qəbul edilməz. Yaxşı, bəs nə üçün başqasının ona qarşı etdiyi haqsızlıqlara qarşı qədərin dəlil göstərilməsini qəbul etmirsə, Uca Allahın haqlarını tapdalayaraq qədəri öz leyhinə dəlil göstərməsi necə düzdür? Möminlərin əmri Ömər b. əl-Xəttab - *radıyallahu anhu* – nun dövründə oğurluq üçün əlinin kəsilməsi hökmü verilmiş birisini gətirirlər. O, da əlinin kəsilməsi qərarını verdikdə oğru: «Ağır ol! Ey möminlərin əmri. Mən Allahın qədəri ilə oğurluq etdim» dedi. Ömər - *radıyallahu anhu* – da: «Bizlərdə ancaq Allahın qədəri ilə sənin əlini kəsirik» deyə cavab verdi.

Qədərin əsli Allahın sirridir. O, haqda biliyə nə bir mələk, nə bir peyğəmbər, nə də onlardan aşağı olan hər hansı bir insan sahib deyildir. Bu haqda dərinliyə dalmaq, düşünmək və cürbəcür fikirlər yürütmək doğru deyildir. İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qədərdən danışanda susun» . Əli - *radıyallahu anhu* – deyir ki, qədər Allahın sirridir. Onu açmayasan. Kim qədərin dərinliyinə dalmaq istərsə gedəcəyi yol xüsran və məhrumiyyətdir. Bu yolda xeyr əldə etməyib hidayətdən məhrum olar. Şişirdər və həddi aşar. Çünki qədərin həqiqətini Allahdan başqa heç kəs bilməz. İnsanlar nə qədər

---

[1632] İbn Macə, 2045; Beyhəqi, 7/356. əl-Albani «Mişkətul-Məsabih» 6293-cü hədis.

[1633] Təbərani «Məcmul Kəbir» 10/223,224, Əbu Nuaym «Hilya» 4/108, əl-Ləlakai «Şərhu Usuli Etiqad» 1/126, əl-Albani «Səhih Hədislər Silsiləsi» 1/46.

düşünürlərsə düşünsünlər, qədərin həqiqətinə vara bilməzlər. Ancaq biz, Əhli Sünnə vəl Cəmaat Allahın hər şeyi bildiyinə, yazdığına iman edirik. ***«Elmdə qüvvətli olanlar isə: «Biz onlara inandıq, onların hamsı Rəbbimiz tərəfindəndir» deyərlər. Bunları ancaq ağıllı adamlar dərk edərlər.*** *(Ali İmran 7).*

## ALLAH - *Subhənəhu Və Təalə* – NİN İRADƏSİ (İSTƏMƏSİ)

Əhli Sünnə Vəl Cəmaat iman gətirir ki, Allah - *subhənəhu və təalə* – istədiyini edəndir. ***«O, istədiyini edəndir».*** *(əl-Buruc 16).* Allah nəyi istəmişsə onu da edir və Ona mane olan bir şey də yoxdur. Məxluqa gəldikdə isə o, istədiyini edə bilmir. Çünki bəzən görürsən ki, insan bir şeyi istəyir lakin onu etməyə aciz və qadir olmur. Bəzən də bir şeyi etməyə qadir olduğu halda istəyir lakin onunla istədiyi şey arasına maneə girir. Məxluq hər dəfə istədiyini edə bilmir. Lakin Allah istədiyini istədiyi vaxt «***OL!***» deməklə edir. ***«Bir şeyi yaratmaq istədiyi zaman Allahın buyurduğu ona ancaq: «Ol!» deməkdir. O, da dərhal olar.*** *(Yasin 82) və etdiyi şeylər barəsində soruşulmur.* ***«Allah gördüyü işlər barəsində sorğu-sual olunmaz. Onlar*** *(bütün bəndələr)* ***isə sorğu-sual ediləcəklər».*** *(əl-Ənbiya 23)* – Bu ayədə sorğu-sual olunmaz – sözündən qəsd Allahın etdiyi hər bir iş hikmətə uyğundur. Heç kəs deyə biməz ki, Allah bu işi əbəs yerə edib. İnsanlar isə etdikləri işlər barəsində sorğu-sual ediləcəklər. Çünki onlar hər bir işi hikmətlə edə bilməzlər.

Biz iman gətiririk ki, Allahın iradəsi (istəyi) iki cürdür: 1. ***Kovni İradə.*** 2. ***Şəri İradə.***

***Kovni İradə*** – Allahın yaratması, əzəli qədər və s. başa düşülür. Allahın istədiyi şey mütləq mənada olmalıdır. Olmaması mümkün deyildir. Kovni iradə baş verən hər bir şeyi əhatə edir. İstər şərr olsun, istər xeyir. O, baş verən şeyin Allaha sevimli olması da vacib deyildir. Məs: İblisin və əsgərlərinin var olmasını diləməsi kimi, insanların etdikləri günahları, fahiş işləri Allah kovni olaraq istəyib. Lakin Allah kafirləri sevməz, fasiqlər topluluğundan razı qalmaz, həyasızlığı əmr etməz, qullarının da kafir olmalarına razı olmaz, fəsadı da sevməz. ***«Allah fitnə-fəsadı sevməz».*** *(əl-Bəqərə 205).* ***«Yer üzündə təkəbbürlə gəzib dolaşma. Çünki sən nə yeri yara bilər, nə də*** *(boyca)* ***yüksəlib dağlara çata bilərsən. Bütün bunlar Rəbbinin dərgahında bəyənilməyən pis şeylərdir».*** *(əl-İsra 37,38).* ***«Amma bəndələrinin küfr etməsi Ona xoş getməz».*** *(əz-Zumər 7).* Allah təqva sahiblərini, ehsan edənləri, ədalətli olanları, iman edib saleh əməl işləmələrini Allah kovni olaraq istəyir və həmçinin də bu əməllər Allaha sevimlidir. Kovni iradə mütləq baş verir və onun gecikməsi də mümkün deyildir. Həmçinin də bu baş verən şeyin də Allaha sevimli olması şərt deyildir.

Bəs onda Allah necə sevmədiyi bir şeyi istəyə bilər. Allahı məcbur edənmi var? İnsanlar içərisində heç kəs istəmədiyi bir şeyi etmir. Lakin biz deyirik ki, heç kəs və heç nə Allahı bu aləmdə məcbur edə bilməz. Lakin Allahın sevmədiyi bir şeyi istəməsində xeyir vardır. Hansıki o, xeyir məsləhət xoşlamadığı bir şeydən daha da üstündür. Məs: Kafirlərin küfrü. Əgər onlar küfr etməsəydilər Allahın yaratdıqlarında etdiyi hikməti yoxa çıxardı. Əgər kimsə mömin, kimsə kafir olmasaydı artıq əmrlər və qadağalar yoxa çıxardı. ***«Sizi yaradan Odur. Kiminiz kafirsiniz, kiminiz mömin. Allah nə etdiklərinizi görəndir!».*** *(ət-Təğabun 2).* ***«Əgər Rəbbin istəsəydi bütün insanları tək ümmət edərdi… Artıq Rəbbinin: «Mən Cəhənnəmi bütün cinlər və insanlarla***

***dolduracağam!» – sözü təmamilə yerinə yetdi».*** *(Hud 118,119).* Allah ayədə buyurur ki, Cəhənnəmi insanlar və cinlərlə doldurmaq kəliməsi artıq tam olaraq yerinə yetdi. Əgər Allah onları müxtəlif yaratmasaydı Allahın vədi yerinə yetməzdi. Əgər insanlar bir ümmət və bir dində olsalardı onda mömin və kafir bilinməzdi. ***«Məgər biz müsəlmanları kafirlərlə eynimi tutacağıq!».*** *(Nun 35).* ***«Yoxsa Biz iman gətirib yaxşı işlər görənləri yer üzündə fitnə-fəsad törədənlərlə eyni tutacağıq. Yaxud Allahdan qorxub pis əməllərdən çəkinənləri günahkarlara tay edəcəyik».*** *(Sad 28).* ***«Yoxsa dünyada pis əməllər edənlər*** *(axirətdə)* ***onları iman gətirib yaxşı işlər görənlərlə bir tutacağımızı, onların həyatlarının və ölümlərinin eyni olacağını güman edirlər! Onlar nə pis mühakimə yürüdürlər!».*** *(əl-Cəsiyə 21).*

Əgər sizə sual verilsə ki, Allah məni hidayət yolundan uzaqlaşdırıb həlak yoluna yönəldərsə O, mənə yaxşılıq edib, yoxsa pislik. Cavab: «Əgər O, sənə sənin haqqını verməyibsə artıq pislik etmişdir. Əgər öz fəzilətindən verməmişsə o, da Allahın rəhmətindəndir ki, qullarından istədiyinə verir. Məs: On kasıb sənin qarşında durub ki, sən onlara nə isə verəsən. Sən də beş nəfərə nə isə verirsən. Sən vermədiklərinə pislikmi etdin? Xeyr. O, beş nəfərə isə öz fəzilətindən istədiyinə verdin. Həmçinin Allah da hidayəti fəziləti ilə istədiyinə verir. ***«Əgər Allah istəsəydi bu peyğəmbərlərin ardınca gələn insanlar onlara göndərilən aşkar dəlillədən sonra bir-biriləri ilə vuruşmazdılar. Fəqət ixtilafa düşdülər. Onlardan bəziləri Allaha iman gətirdilər, bəziləri isə kafir oldular. Əgər Allah istəsə idi, onlar bir-biriləri ilə vuruşmazdılar. Lakin Allah öz istədiyini edər!».*** *(əl-Bəqərə 253).* Onların döyüşmələri Allaha sevimli deyildir. Lakin Allah kövni olaraq bunu istəyir. ***«Əgər Allah sizi azdırmaq istəyirsə mən sizə nəsihət vermək istəsəm də heç bir faydası olmaz. O, sizin Rəbbinizdir və siz Onun hüzuruna qaytarılacaqsınız».*** *(Hud 34).*

***Şəri İradə*** *–* Şəri iradə Allahın sevdiyi, razı qaldığı, şəriət etdiyidir. Günahları və bu günahları edənləri sevmir və insanlara da əmr etmir. Bunu Kovni qədər ilə yaratsa da belə. Bundan razı deyil və sevmir. Başqa bir şey ola da bilməz. ***«Allah sizə bilmədiklərinizi bildirmək, sizdən əvvəlkilərin getdiyi yolları göstərmək və tövbələrinizi qəbul etmək istər. Allah hər şeyi biləndir və hikmət sahibidir! Allah sizin tövbələrinizi qəbul etmək istəyir. Öz nəfsinə uyanlar isə sizi böyük bir əyriliklə düz yoldan sapdırmaq istəyirlər. Allah istər ki, üzərinizdə olan ağırlığı yüngülləşdirsin, çünki insan zəif yaradılmışdır».*** *(ən-Nisa 26-28).* ***«Allah sizi çətinliyə salmaq istəməz, lakin O sizi pak, təmiz etmək və sizə olan nemətini tamamlamaq istər ki, bəlkə şükr edəsiniz!»*** *(əl-Maidə 6).* ***«Allah sizdən çirkinliyi yox etmək və sizi tərtəmiz, pak etmək istər!»*** *(əl-Əhzab 33).* Şəri istək kovni istəyin tam əksidir. Şəri istəkdə hər bir şey Allahın sevdiyi şeylərdir. Lakin şərrən istədiyi şey hər zaman baş vərməyə də bilər. Məs: Allah istəyir ki, qullarının ibadət etmələrini, əmr etdiklərini yerinə yetirməyi və qadağan etdiklərindən çəkinmələrini, mömin olmalarını istəyir. Lakin bu hər zaman baş verməyə də bilər. Hamı mömin deyildir. Bu şəri istəkdir. Lakin kovni istəklə Allah onların kafir olmalarını istəyir. Kovni istək də mütləq baş verir. Allahın kovni və şəri iradəsi də hikmətə tabedir.

## KOVNİ VƏ ŞƏRİ İRADƏ ARASINDA FƏRQ

1. Kovni iradə Allahın əzəli istəyi və yaratması ilə bağlıdır. Kovni iradə baş verir Allah bu iradədən razı qalsa da, qalmasa da belə. Şəri iradə isə Allahın məhəbbəti, razı qalması, şəriət etməsi ilə bağlıdır.

2. Kovni iradə mütləq baş verəcəkdir. Baş verməməsi mümkün deyildir. Şəri iradə isə yalnız səbəbləri götürənlərdə baş verir. Ola bilər ki, baş versin. Ola bilər ki, baş verməsin.

3. Kovni iradə Allahın məhəbbətindən aslı deyildir, şəri iradə isə Allahın məhəbbətindən aslıdır.

4. Kovni iradə bütün məxluqata yonəldilmişdir, şəri iradə isə mükəlləflərə (ağlı başında olan və həddi-buluğa çatanlara) yönəldilmiş-dir. Məs: Körpə uşağa biz namaz qılmağı əmr etmirik. Çünki həddi-buluğa çatmayıb və ağlı da başında deyildir. Lakin kovni olaraq o, uşağın ağlaması, külməsi yazılmışdır.

# KOVNİ VƏ ŞƏRİ İRADƏYƏ ƏSASƏN ALLAHIN İRADƏSİ BU DÖRD HALDA OLA BİLƏR

1. Allahın hər iki iradəsinin eyni anda baş verməsi: Kovni və Şəri iradənin bir insanda cəm olması Saleh əməllər etməsi və qadağalardan çəkinməsidir[1634].

2. Yalnız Şəri iradə ilə baş verir, kovni iradə isə yox. Bu o, saleh əməllərdir ki, Allah bizlərə şərən buyurub. Lakin bu əməlləri kafirlər, fasiqlər tərk edərək asiliklər edirlər. Kafirlərə iman gətirmək əmr olunub, fasiqlərə isə asiliklər etməmək əmr olunmuşdur. Lakin onlar Allahın şəriətinə müxalif çıxaraq asiliklər edirlər və bu da kovni olaraq baş verir, şəri olaraq isə yox. Allah Fironun, Əbu Cəhlin, Əbu Talibin iman gətirib, saleh əməl etməsini istəyirdi, lakin kovni olaraq bu belə deyildir. Ona görə də kovni iradə baş verir, şəri iradə isə yox. Baş verib-verməməsindən aslı olmayaraq Allah Şəri iradədən razıdır.

3. Yalnız kovni iradədən aslı olan əməllərdir. Allah həmən əməlləri Kovni olaraq istəyib və qədər edib, lakin edilməsini bizlərə əmr etməyib. Bu da mübah olan əməllər, fasiqlik, asilik, fahiş işlər və s. Allah bunları sevmir və bunlardan razı da deyildir. Lakin Qədər edibdir. Şərən isə bizə buyurmamışdır.

4. Allah onu nə Kovni olaraq istəyib, nə də Şəri olaraq istəyib. Bu növə baş verməyən və yaradılmayan asiliklər, icazəli əməllər daxildir. Asiliklər olduğuna görə Allah sevmir, istəmir. Kovni olaraq istəmədiyinə görə də baş verməyib. Kovnən onu istəməyib, istəsəydi baş verərdi.

# ƏRŞ VƏ QƏLƏM

İbn Ömər, Ubadə İbn Sabit və İbn Abbas - *radıyallahu anhum* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və salləm* – buyurdu: «Heç şübhəsiz ki, Allahın ilk yaratdığı şey qələmdir». Ona: «Yaz!» deyə buyurdu. Qələm: «Ya Rəbbim! Nə yazım» dedi. Allah: «Qiyamətin qopacağı vaxta qədər hər bir şeyin qədərini yaz!» deyə buyurdu[1635]. Abdullah b. Amr b. əl-As - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah

---

[1634] Məcmuul Fətava 8/198.

[1635] Əbu Davud 2155,3319, Tirmizi 3319, Musnəd 5/317, İbn Əbi Asim "Sünnə" 102-107, əl-Albani "Ziləlul Cənnə" 1/48-50, "Mişkət" 94, "Səhih Silsilə" 133. Şeyx, mühəddi əl-Albani – *rahmətullahi aleyhi* – sözü keçən bu hədis ilə əlaqəli gözəl bir təhrici vardı. Bu təhricdə «Ona yaz dedi» sözünün başında bir «***Fə***» və ya «***Summə - Sonra***» olmasını təhric etmişdir. Buna görə də o, qələmin ərşdən öncə yaranmış olduğunu, ərşin isə yazmadan öncə yradılmış olduğunu təhric etmişdir".

– *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah məxluqatın (qəza və qədərini) göyləri və yeri yaratmamışdan əlli min il əvvəl yazmışdır. Ərşi də suyun üzərində idi» .

Bu hədislərə görə elm adamları Ərş və qələmin hansının daha öncə yaradılmış olduğu xüsusunda fərqli görüşlərə sahibdirlər. Böyük elm adamı İbn Qeyyim – *rahmətullahi aleyhi* – bu xüsusda iki görüş nəql etmiş və ərşin qələmdən öncə yaradılmış olduğu görüşünü tərcih etmişdir. O, «ən-Nuniyə» adlı əsərində deyir: «İnsanlar görüş ayrılığına düşmüşlər. Qələm xüsusunda, ərşdən öncəmi idi? Yoxsa ondan sonramı idi? İki görüş vardır. Əbu Əla əl-Həmədaniyə görə həqiqət budur ki, ərş öncədir. Çünki yazmadan əvvəl onun (ərşin) rukunları vardı. Yazma isə sonradan gerçəkləşir» .

Hədisdən də göründüyü kimi qələmin yaradılması (yəni qədərin yazılması) ərşin yaradılmasından sonra meydana gəlmişdir. Məxluqatın qədəri isə Qələmin yaradılması ilə birlikdə olmuşdur. Bu qələm də qələmlərin ilki, ən fəzilətlisi və ən dəyərlisidir. Təfsir alimlərinin bir çoxu belə deyirlər: «Bu qələm Uca Allahın: ***«Nun! And olsun qələmə».*** *(Qələm 1)* buyurduğunda and içdiyi qələmdir».

***Birinci*** - qələm qiyamət gününə qədər meydana gələcək hər bir hadisəni və hər bir varlığı yazmış olduğuna görə bütün bunlar qələm ilə yazılana uyğun olaraq meydana gəlirlər. Buna görə də insanın başına gələn hər bir şey onu ötüb keçməməli idi. Onu ötüb keçən hər bir şey isə onun başına gəlməməli idi. Cabir b. Abdullah - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qədərin xeyri və şərri ilə Allahdan olduğuna iman etmədikcə və sənin başına gələn hər bir şeyin səni ötüb keçməməsinə, sənin başına gəlməyən bir şeyin isə sənə toxunmamasına kəsinliklə inanmadıqca heç bir qul iman etmiş olmaz» .

***İkinci*** - qələm isə vəhy qələmidir. Allahın Peyğəmbərlərinə və Rəsullarına göndərmiş olduğu vəhyi yazdığı qələmdir. Bu qələmlərin sahibləri mələklərdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – İsra gecəsində qələmlərin cızıltılarını eşitdiyi bir yerə qədər çıxarılmışdır .

***Üçüncü*** - qələm isə Mələyin, insan ana bətnində olarkən göndərilərək ona ruh üflər və dörd şeyi yazmaqla əmr olunar. Əbu AbdurRahmən Abdulla b. Məsud – *radıyallahu anhu* – rəvayət edir ki, doğru sözlü və doğru sözü təsdiq olunan Rəsulullah - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizdən hər birinizin yaradılışı onun anasının qarnında qırx gün nütfə şəklində olaraq bir yerə gətirilir. Sonra bu müddət qədər aləqa şəklində olur. Sonra yenə bu müddət qədər mudğa şəklində olur. Sonra ona bir mələk göndərilir, mələk ona ruh üflədikdən sonra dörd xüsusiyəti yazmaqla əmr olunur. Ruzisini, əcəlini, əməlini, bədbəxt və ya xoşbəxt olacağını» .

***Dördüncü*** - qələm qulun həyata gəlməsi ilə onun əməllərini yazan qələmdir. Bu da Kiramə və Kətibin mələkləridir ki, Adəm oğullarının əməllərini yazırlar. Allah onları üzərimizə əməllərimizi, sözlərimizi və davranışımızı yazmaq üçün mükəlləf edib. Bizi ancaq ayaq yoluna girdiyimiz və cima halında tək buraxarlar. ***«Sizin üstünüzdə gözətçi***

---

[1636] Müslim.
[1637] əl-Hərras «Şərhu Nuniyə» 1/165, İbn İsa Şərhi 1/374.
[1638] «Səhihul Cəmi» 7461, «Cəmiul Usul» 7574, 7575, 7576.
[1639] Buxari, Müslim.
[1640] ***Nütfə*** – məni mənasındadır. Nütfə bəzən də saf su adlanır.
[1641] ***Aləqa*** – laxtalanmış qan, ziyil deməkdir. ***«O, insanı laxtalanmış qandan yaratdı».*** *(əl-Ələq 2).*
[1642] ***Mudğa*** – çeynənilmiş ət parçasına oxşadığı üçün bu ad verilmişdir.
[1643] Fəthul Bəri 11/477, Müslim 2643.

***mələklər*** *(əməllərinizi)* ***yazan və*** *(Allah dərgahında)* ***çox hörmətli mələklər vardır. Onlar sizin nə etdiklərinizi bilirlər».*** *(əl-İnfitar 10-12).* ***«Şübhəsiz ki, elçilərimiz qurduğunuz hiylələri*** *(əməl dəftərinizə)* ***yazırlar».*** *(Yunus 21).* ***«Yoxsa onlar elə güman edirlər ki, biz onların pıçıltılarını və xəlvəti danışıqlarını eşitmirik! Xeyr, yanlarında olan elçilərimiz yazırlar».*** *(əz-Zuxruf 80).* ***«İnsan üçün onu öndən və arxadan təqib edən mələklər vardır. Onlar insanı Allahın əmri ilə qoruyurlar».*** *(ər-Rəd 11).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* –buyurdu: «Sizinlə birlikdə ayaq yoluna girdiyiniz vaxt ilə cima halından başqa sizdən ayrılmayan mələklər vardır. Onlardan həya edin və onlara ikramınız olsun» .

## MUSA VƏ XIDIR
## – *Əleyhimussəlam* –

Bəzən insanlar Allahın qədəri ilə baş vermiş hadisələrdə olan hikməti anlaya bilmir və ya görmürlər. Lakin hərdən Allah insanlara bu hikməti açaraq göstərir və insanlar baş vermiş bədbəxtçiliyin, zülmün, fəlakətin onlar üçün fayda və xeyirlərlə dolu olduğunu görürlər. Buna misal olaraq: Musa və Xıdır - *əleyhimussəlam* – ın hadisəsini söyləmək kifayət edər.

Səid b. Cubeyr - *radıyallahu anhu* – deyir ki, İbn Abbas - *radıyallahu anhu* – ya dedim: «Kufədə Noufa əl-Bikali adında bir nəfər vardır. İddia edir ki: Xızır – *əleyhissəlam* – ilə olan Musa – *əleyhissəlam* – İsrail Övladlarına göndərilən (Peyğəmbər) olan Musa – *əleyhissəlam* – deyildir. İbn Abbas - *radıyallahu anhu* – (qəzəblənərək) Allahın düşməni yalan söyləmişdir. Həqiqətən mənə Ubey b. Kəb - *radıyallahu anhu* – belə rəvayət etdi ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «(Bir gün) Musa – *əleyhissəlam* – İsrail oğullarına xütbə ilə müraciət etdi. Müraciətdən qəlblər yumşaldı və gözlər isə yaşardı. Sonra onlardan bir nəfər Musanın arxasınca gedərək (və ya İsrail oğulları): «İnsanların ən elmlisi (alimi) kimdir?» deyə soruşdular. Musa: «İnsanların ən elmlisi (alimi) mənəm? (Başqa rəvayətdə: Bilmirəm)» deyə cavab verdi. Lakin bu xüsusda elmi: «Allah ən gözəl bilir!» deyərək Allaha həvalə etmədiyindən ötrü Allah onun bu sözlərinə etiraz bildirərək: «Həqiqətən iki dənizin qovuşduğu yerdə mənim qullarımdan biri vardır ki, o səndən də çox elmlidir!» deyə ona vəhy etdi. Musa: «Ya Rəbbim! Mən onunla necə görüşə bilərəm?» deyə soruşdu. Ona: «Zənbilin içinə bir balıq qoy və (səfərə çıx), harada balığı itirsən mənim qulum orada olacaq! (Başqa rəvayətdə: Ölü balığı götür və onunla (Xızır) ilə görüşəcəyin yerdə balığa can veriləcəkdir)» deyə buyrudu. Bundan sonra Musa, yanında gənc xidmətçisi olan Yuşa b. Nun[1645] ilə birlikdə səfərə çıxdılar. Balığı zənbilin içində (xidmətçisi) daşıyırdı.

Nəhayət (iki dənizin qovuşduğu yerdə) bir qayanın yanına çatdılar. (İstirahət üçün qayanın yanında) Musa və yanındakı gənc xidmətçisi yuxuya daldılar. Bu an (zənbildə gətirdikləri) balıq zənbildən sıçrayıb çıxaraq dənizdə bir yarğana tərəf üz tutdu. (Dəniz içində belə bir yarğanın (yolun) açılması) Bu hal gənc xidmətçini çox təcübləndirdi. Xidmətçi bu haqda Musa – *əleyhissəlam* – xəbər verməyi unutdu. (Oyandıqdan sonra) onlar yollarına davam edərək bütün gecəni yol getdilər. Səhər açıldıqda, Musa öz xidmətçisinə: «Nahar yeməyimizi gətir. Bu səfər bizi lap əldən salıbdır!» dedi. Halbuki

---

[1644] Tirmizi 2800.
[1645] İncildə: İsus Navin.

Musa (görüş üçün) əmr olunduğu yeri keçmədikcə heç bir yorğunluq hiss etməmişdir. Xidmətçisi: «İş burasındadır ki, biz qayanın yanında olduğumuz vaxt mən balıq haqqında təmamilə unutmuşdum. Doğrusu onu xatırlamağı mənə şeytandan başqası unutdurmadı. Balıq (dirilib) əcaib bir şəkildə dənizə tərəf yollandı!» deyə cavab verdi. Musa: «Elə bizim axtardığımız da budur!» deyə cavab verdi. Onlar öz izlərinə (ləpirlərinin) izinə düşərək gəldikləri yoll geri qayıtdılar. Gənc xidmətçi balığın getdiyi yeri ona göstərdi. Musa: «Mənə vəsf olunan yer elə buradır deyərək ətrafında o, şəxsi axtarmağa başladı. Nəhayət qaynın yanına çatdıqda əbaya bürünərək arxası üstə yatmış vəziyyətdə birisini – Xıdırı[1646] gördülər (Başqa rəvayətdə: Xızır – dənizin ortasında, yaşıl xalçanın üzərində, əbasına bürünmüş olaraq gördük. Əbanın bir ucu ayaqlarının altında, digər ucu isə başının altında idi)». Musa: «Əssələmu Aleykum!» deyə onu salamladı. Xıdır üzünün örtüyünü açaraq: «Və Aleykuməs Salam! Sənin ölkəndə belə bir salam haqqında haradan bilirlər?» deyə soruşdu. Musa: «Mən – Musayam!» deyə cavab verdi. Xıdır: «İsrail oğullarından olan Musasan?» deyə soruşdu. Musa: «Bəli!» deyə cavab verdi. Xıdır: «Sən Allahın sənə öyrətdiyi elə bir elm üzərindəsən ki, mən onu bilmirəm. Mən də Allahın mənə öyrətdiyi elə bir elm üzərindəyəm ki, sən onu bilmirsən!» dedi. Musa: «Öyrədildiyin doğru yolu göstərən elmdən mənə öyrətmək şərtilə sənə tabe olummu?» deyə soruşdu. Xıdır: «Doğrusu sən (məndən öyrənmək üçün) mənimlə bir yerdə əsla səbr edib dözə bilməzsən. Axı sən (batininə, mahiyyətinə bələd olmadığın) bilmədiyin bir şeyə necə səbr edib dözə bilərsən (Başqa rəvayətdə: Məgər sənə əlində olan Tövrat və vəhyin gəlməsi kifayət deyilmi?). (Yəni – sənin onlara səbrin çatmaz, çünki mən batini elmlə iş görürəm. Sənin bildiyin isə ancaq zahiri elmdir)» deyə cavab verdi. Musa: «İnşəallah! Mənim səbrli olduğumu görəcəksən və sənin heç bir əmrindən çıxmayacağam!» deyə cavab verdi. Xıdır: «Əgər mənə tabe olacaqsansa, səbəbini sənə izah etmədikcə məndən heç bir şey haqqında soruşma» deyə cavab verdi. Musa: «Bəli!» dedi. Xıdır ilə Musa – *əleyhimussəlam* – gəmiləri olmadığı üçün dənizin sahili ilə getməyə başladılar. (Bir müddətdən sonra) bir gəminin yanına çatdılar. Onları da gəmiyə götürmələri üçün (dənizçilərdən) xahiş etdilər. Gəmiçilər Xıdır - *əleyhissəlam* – ı tanıdıqları üçün onlardan heç bir gediş haqqı da tələb etmədilər. (Bir müddətdən sonra) bir sərçə uçub gələrək gəminin kənarına qondu və dənizdən bir, iki dimdik su götürdü. (Bunu görəcək) Xıdır: «Ya Musa! Sənin aldığın elm ilə, mənim aldığım elm Allahın elmindən bu sərçənin dənizdən əskiltdiyi qədər belə əskiltməz!» dedi. (Bir müddətdən sonra) Xıdır gəminin (taxtalarından) birinə əl atıb onu sökməyə başladı. Musa: «(Bu) insanlar bizi öz gəmilərinə heç bir gediş haqqı tələb etmədən götürdülər. Sən isə bilə-bilə onların gəmilərini deşdin ki, onları suya qərq edərək batırasan. Doğrusu olduqca məzəmmətə layiq bir iş gördün!» dedi. Xıdır: «Mən sənə demədimmi ki, sən mənimlə bir yerdə (görəcəyim işlərə) görə əsla səbr edib dözə bilməyəcəksən!» deyə cavab verdi. Musa: «Unutduğum bir şeydən ötrü məni danlama və məni öz işimdə (sənə tabe olmaqda) çətinliyə salma!» dedi. Beləliklə Musa – *əleyhissəlam* – (səfərin ilk başında) birinci dəfə unutqanlıq göstərdi. Gəmidən düşdükdən sonra onlar yollarına davam etməyə başladılar. (Bir müddətdən sonra) uşaqlarla oynayan gözəl (kafir) bir oğlan uşağını gördülər. Xıdır – *əleyhissəlam* – dərhal (uşaqlarla oynayan) oğlan uşağının yanına yaxınlaşaraq əliylə onun başından

---

[1646] ***Xıdır*** – yaşıl, yaşıllıq deməkdir. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Xıdıra – Xıdır deyilməsinin səbəbi budur: «Xıdır otsuz quru bir yerə oturduğu zaman o, otsuz yer yaşıllıqa qərq olardı (bürünərdi)» Buxari 3402.

tutub yerində qopardı! (Başqa rəvayətdə: Yerə yıxaraq onu bıçaqla urdu)». Musa: «Heç bir günah iş tutmayan, buna görə də qisasa layiq olmayan pak, məsum bir cana qəsd etdin? Doğrusu olduqca məzəmmətə layiq bir iş gördün!» dedi. Xıdır: «Mən sənə demədimmi ki, sən mənimlə bir yerdə (görəcəyim işlərə) görə əsla səbr edib dözə bilməyəcəksən!» deyə cavab verdi. Musa: «Əgər bundan sonra səndən bir şey haqqında xəbər alsam, bir daha mənimlə yoldaşlıq etmə. (Hərəkətlərinə etiraz etdiyim, səni qınadığım üçün) sən artıq mənim tərəfimdən üzürlüsən (məni atıb getməyə haqqın vardır) deyə cavab verdi. Sonra yenə də yollarına düzəlib getdilər. Axırda bir məmləkətin əhalisinə yetişib, onlardan yeməyə bir şey istədilər. Məmləkətin əhalisi onları qonaq (müsafir) etməkdən çəkindilər. Onlar o, məmləkətdə yıxılmaq (uçulmaq) üzərə olan bir divar gördülər. (Xıdır) o, divarı əlilə düzəltdi. Musa: «Bunlar elə bir qövümdür ki, biz onların yanına gəldik, lakin onlar bizi qonaq (müsafir) etməkdən çəkindilər. İstəsəydin sözsüz ki, bu iş müqabilində onlardan (çörək pulu) alardın!» dedi. Xıdır: «Bu o, deməkdir ki, artıq biz səninlə ayrılmalıyıq. Zahiri gördüyün və dözə bilmədiyin şeylərin daxili mənasını (batinini, mahiyyətini) sənə xəbər verəcəyəm.

Belə ki, gəmiyə gəlincə o, dənizdə işləyən bir qurup yoxsula məxsusdur. Ona görə mən onu xarab etdim ki, bu adamların arxasında hər bir yaxşı gəmini zorla (ədalətsiz olaraq) ələ keçirən bir hökmdar (Hudad b. Budad adlı hökmüdar) vardır. Gəmini almaq üçün gələn hökmüdar onun deşik olduğunu gördüyü zaman onu zorla ələ keçirməkdən vaz keçdi. Sonra gəmi sahibləri o, gəmini taxta ilə düzəldib təmir etdilər. Oğlan uşağına gəldikdə isə onun ata-anası mömin kimsələr idi. (Mən onun daxilinə baxıb) gördüm ki, həddi-buluğa yetişdiyi zaman kafir olacaqdır. Böyüdükdə isə ata-anasını da öz arxasınca azğınlığa, küfrə sürükləyəcəkdir. İstədim ki, Rəbbi onun əvəzində onlara daha təmiz və ata-anasına qarşı daha mərhəmətli olan başqa bir övlad versin (Başqa rəvayətdə: Qız övladları dünyaya gəlir). Divara gəldikdə isə o, məmləkətdə yaşayan iki yetim oğlanındır. Altında onlara çatan bir xəzinə vardır. Onların atası əməlisaleh bir adam idi. Allah onların həddi-buluğa çatmalarını və Rəbblərindən bir mərhəmət olaraq öz xəzinələrini tapıb çıxarmalarını istədi. (Ya Musa!) Mən bunları öz-özümdən etmədim. (Yalnız Allahın əmrini yerinə yetirdim). Sənin səbr edib dözə bilmədiyin şeylərin daxili (batini) mənası budur!» dedi. Peyğəmbər: «Allah Musaya rəhmət etsin! İstərdim ki, o, daha çox səbr edərdi və biz də onların aralarında baş verən hadisələrdən daha çox xəbərdar olardıq!» deyə buyurdu[1647].

Bu dünyada baş verən hadisələrdən danışdığımız zaman Allaha qarşı ədəb formalarına diqqət etməliyik. Xıdır – *əleyhissəlam* – xeyirin (bərəkətin) Allahdan olduğuna: ***"Rəbbin onların həddi-buluğa çatmalarını və Rəbbindən bir mərhəmət olaraq öz xəzinələrini tapıb çıxartmalarını istədi".*** *(əl-Kəhf 82),* Həmçinin Musa – *əleyhissəlam* – ın köməkçisi balıq barədə unutduqda demədi ki: "Bunu mənə Allah unutdurdu". Əksinə bunu Şeytana nisbət etdi. ***"Doğrusu, onu xatırlamağı mənə yalnız şeytan unutdurdu".*** *(əl-Kəhf 63).* Şərrin və Xeyrin Allah tərəfindən yaradılması və təqdir edilməsinə baxmayaraq şərr Allaha nisbət edilməz. Şeyx Useymin – *rahmətullahi aleyhi* - "Əqidətl Vasitiyyə" 1/70,71 deyir ki: "Xeyir və Şərrin Qədərdən olduğuna iman gətirmək – Şərdən qəsd – baş verən (təqdir edilən) hadisələrin şərr olmasıdır, Qədərin özü isə şərr deyildir. Uca və böyük olan Allahın əməli şərr ola bilməz. Çünki Onun əməli Xeyir və Hikmətlə doludur. Şərr Alahın təqdir etdiyi və yaratdığındadır. Allahın əməlində isə şərr yoxdur. Peyğəmbər – *sallallahu aleyhi və*

---

[1647] Buxari 1/169, H. 74, 1/174, H. 78, 1/217, H. 122, 4/445, H. 2267, 3278, 3400, 4726, Müslim 2380.

*səlləm* – buyurdu: "Şərr sənə nisbət edilməz...". Bizlər şərr olaraq təqdir olunanda və yaradılanda görürük. Vəhşi heyvanlar, ilanlar, əqrəblər, quraqlıq, xəstəliklər, kasıblıq və s. Bütün bunlar insanlar üçün şərdir. Çünki insan bunları qəbul edə bilmir. Həmçinin asiliklər, günahlar, bədbəxtçilik, qətillər və s. şərdir. Lakin bütün bunlar Allah üçün xeyirdir. Çünki Allah bunlarda böyük hikmətlər və faydalar təqdir etmişdir. Allahın istədiyi kimsələr bu hikmətləri görür, diləmədiyi kimsələr isə bunları görməzlər. Bizə şərr kimi görünən bir çox hadisələrdə faydalar ola bilər. ***"İnsanların öz əlləri ilə etdiyi əməllərinin nəticəsi olaraq quruda və dənizdə fəsad törəyir ki, Allah onlara, etdiklərinin bir qismini daddırsın. Bəlkə, onlar haqqa qayıdalar".*** *(ər-Rum 41).*

## ADƏM VƏ MUSA
## – *Əleyhimussəlam* –

Üsyankarlar etdikləri günahları, asiliklərini Allahın onlar üçün yazdığı qədərin bir nəticəsi olaraq göstərməyə çalışırlar. Öz xətalarını, günahlarını qədərin üzərinə yükləyirlər. Bu mövzuda dəlilləri isə Adəm ilə Musa – *əleyhimussəlam* – ın Allahın dərgahında bir-birləri ilə mücadələ etmələri ilə əlaqədar olan hədisdir. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Adəm ilə Musa – *əleyhimussəlam* - Rəbbləri qatında bir-birləri ilə mücadələ etdilər. Nəticədə Adəm, Musaya hüccətlə qələbə çaldı. Musa: «Sən, Allahın əli ilə yaratdığı, öz ruhundan üfürdüyü, mələklərini sənə səcdə etdirdiyi, Cənnətdə yerləşdirdiyi, sonra da etdiyin xətadan ötrü insanları yer üzünə endirən Adəm deyilsən?» deyə soruşdu. Adəm: «Sən, Allahın Rəsulu və kəlimi olaraq seçdiyi, içində hər şeyin bəyanı olan Lövhləri verdiyi və səninlə (vasitəçisiz) danışmaq üçün Allahın özünə yaxınlaşdırdığı Musa deyilsən? Səncə Mənim yaradılmağımdan neçə il əvvəl Allahın Tövratı yazdığını bilirsən?» deyə soruşdu. Musa: «Qırx il əvvəl» deyə cavab verdi. Adəm: «Tövratın içində: ***«Və Adəm Rəbbinə asi oldu …».*** *(Ta ha 121)* ayəsini oxudunmu?» deyə soruşdu. Musa: «Bəli, oxudum» deyə cavab verdi. Adəm: «Elə isə Allahın məni yaratmamışdan qırx il əvvəl üzərimə yazdığı və edəcəyim bir işdən ötrü məni qınayırsan?» dedi. Peyğəmbər: «Beləcə Adəm, Musanı hüccətlə məğlub etdi!» deyə buyurdu[1648].

Buna belə cavab verilir. Bu hədis Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən səhih olaraq nəql edildiyi üçün biz onu qəbul edir, dinlər və itaət edərik. Qədəriyyənin etdiyi kimi rədd ilə ravisini yalanlamaqla qarşılıq verməris. Faydasız təvillərə də yol verməris. Səhih olan budur ki, Adəm – *əleyhissəlam* – Qəza və Qədəri günahına dəlil göstərməmişdir. Çünkü o, Rəbbini də, günahını da çox gözəl bilən bir kimsə idi. Onun mömin övladlarından da heç kimsə qədəri günahının əleyhinə dəlil göstərməz. Çünkü bu batil bir şeydir. Musa – *əleyhissəlam* – da öz atasını çox gözəl tanıyırdı. Çünkü atasını da Allah seçmiş, bəyənmiş və hidayətə yönəltmişdir. Bura da olan qınama sadəcə Adəm övladlarını Cənnətdən çıxardan müsibətdir. Adəm – *əleyhissəlam* – ın etdiyi xətaya və günaha görə deyil, müsibətə qədəri dəlil gətirmişdir. Çünkü müsibətlər halında qədəri dəlil gətirmək olar. Ayıblamaq və qüsuru üzə çıxartmaq məqsədilə qədər dəlil göstərilməz. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki, qədər günahlarda deyil, müsibətlərdə dəlil gətrilir. Qulun öz istəyi və iradəsi olmadan başına

[1648] Müslim 2652.

gələn hər bir müsibətdə qədəri dəlil gətirməsində bir xətər yoxdur. Məs: Qulun gözünü, qulağını və s. orqanlarını itirməsi, xəstələnməsi, doğuşdan şikəst çıxması və s. buna bənzər xüsuslarda qədəri dəlil gətirməsində bir xətər yoxdur. Çünkü müsibətlərdə qulun seçimi yoxdur. ***«Yer üzündə baş verən və sizin öz başınıza gələn elə bir müsibət yoxdur ki, biz onu yaratmamışdan əvvəl o, bir kitabda*** *(Lövhi-Məhfuzda)* ***yazılmış olmasın. Bu Allah üçün çox asandır».*** *(əl-Hədid 22).* Günahlara gəlincə isə qulun içki içməsi, zina etməsi, oğurluq və s. kimi günahları işləməsində qədəri misal çəkməsi düzgün deyildir. Çünkü o, bütün bunları öz iradəsi ilə seçərək edir. İbn Qeyyim – *rahmətullahi aleyhi* – «Şifaul Alil» isimli kitabında deyir ki: "İnsan bir günaha batdığı zaman dərhal tövbə edərsə Allah da tövbəsini qəbul edərsə bu vəziyyətdə qədəri dəlil gətirə bilər. Əgər günah edər və günahında davam edərsə bu vaxtı qədəri dəlil gətirməsi batildir. Kafirlərin və müşriklərin vəziyyəti belədir. Adəm – *əleyhissəlam* – da olmuş və bitmiş, təkrarlanmamış bir vəziyyəti dəlil gətirdi[1649]. Allahın əmrinə və iradəsinə təslim olduğu üçün gətirdi. Allahın əmrinə və iradəsinə təslim olunduğu üçün belə vəziyyətlərdə qədəri dəlil gətirmək olar. Lakin Allahın əmr etdiyi tövhid və iman mövzusunda qədərə qarşı çıxdıqları və davamlı şirk içində olduqları halda ondan qaçmadıqları üçün müşriklərin qədəri dəlil gətirmələri batil bir şeydir. ***Müşriklər belə deyəcəklər: «Əgər Allah istəsəydı, nə biz, nə də atalarımız müşrik olar və nə də biz bir şeyi haram edə bilərdik. Onlardan əvvəlkilər də*** *(öz Peyğəmbərlərini)* ***belə təkzib etmişlər. Nəhayət əzabımızı daddılar». Onlara de ki: «Bizim qarşımıza çıxara biləcək bir elminiz varmı? Siz yalnız zənnə qapılır və yalan uydurursunuz».*** *(əl-Ənam 148).* Əgər qədər onların leyhinə dəlil təşkil etsəydı, Allah onlara əzabını daddırmazdı".

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Babamız Adəm – *əleyhissəlam* – ın dəlili daha güclü idi». Babamız Adəm – *əleyhissəlam* – ın dəlilinin gücü nədə idi? Çünki Adəm – *əleyhissəlam* – ın başına gələn hər bir şey Allahın təqdir etdiyi qədər ilə olmuşdu. Bütün bu dəlillər Allahın Qədərini inkar edən Qədərilər və Mötəzilə əqidəsində olanlara rədddir. Allah Tövratı Öz əli ilə Adəm xəlq etməmişdən **40** il əvvəl yazmışdır. Bu da Tövratın möhtəşəmliyinə dəlildir. Abdullah b. Amr - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah üç şeyi əli ilə yaratmışdır. Adəmı, Tövratı əli ilə yazmışdı və Ədn Cənnətindəki (ağacları da) əli ilə əkmişdi»[1650]. Həsənul Bəsri – *rahmətullahi aleyhi* – Bəsrə əhlindən olan, insanın seçimini inkar edənlərə məktub yazaraq deyir: "Kim Qəza və Qədərə iman etməzsə kafirdir. Kim edilmiş günaha görə məsuliyyəti Allahın üzərinə atarsa o, da kafirdir. Heç kəs Allahın iradəsinə zidd olaraq Ona itaət edə bilməz, heç kəs də Onun iradəsinə zidd gedərək Ona asi ola bilməz..."[1651].

Allah şərrindən qorusun İblis, Adəm – *əleyhissəlam* – ın yanına ixlaslı bir nəsihətçi şəkilində gəldi və ağacın meyvəsindən yeyərsə ona bir zərərin toxunmayacağını, əksinə faydası olacağını, Cənnətdə əbədi qalacağını, mələklərdən olacağını və buna bənzər Adəmlə zövcəsini aldatan bir çox şeyi nəsihət olsun deyə Allahın adından and içdi. Adəm – *əleyhissəlam* – isə fitrətinin təmizliyi və nəfsinin hiylədən uzaq olması səbəbiylə İblisin sözlərinin haqq olduğunda şübhə etmədi. Çünkü o, Allah adına yalan yerə and içə biləcəyini zənn etmədi. Adəm və zövcəsi Allah adına içilən anda sayğı

---

[1649] Həmçinin Qədəri günaha sübut kimi bu halda da gətirmək olar: Bağışlanmış bir günah. Əgər tövbə etmisənsə və o, günahdan uzaqsansa. O, günahı edə-edə Qədəri dəlil gətirmək isə doğru deyildir.
[1650] Darakutni «əs-Sifət» s 45, Beyhəqi «əl-Əsmə və əs-Sifət» s 403 Mərfu hədis.
[1651] əs-Səədi "Təfsir" s. 232.

duydular. Lakin İblis bu andın dəyərini doğrultmadı. Buna görə də Allah da onu kiçiltdi və lənətlədi. Adəm və zövcəsini tövbə etməyə müvəffəq etdi. Ayrıca Adəmi Peyğəmbər olaraq seçdi və hidayətə yönəltdi, hidayət rəhbəri etdi.

## XEYİR VƏ ŞƏR

İmam Tahavi – *rahmətullahi aleyhi* – deyir ki, xeyrilə, şərrilə, acısı və sevinci ilə qədərə (Allahın dilədiyinə) iman etmək sözlərinə gəlincə: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – məşhur Cəbrail – *əleyhissəlam* –ın hədisində buyurmuşdur ki, xeyrilə şərrilə qədərə iman etməkdir. ***«Allahın bizim üçün yazdığından başqa bizə heç bir şey üz verməz…».*** *(ət-Tövbə 51).* ***«Onlara bolluq qismət olduğu zaman Bu bizim haqqımızdır deyirlər. Bir pislik üz verdikdə isə bunu*** *(bir uğursuzluq, nəhslik kimi)* ***Musadan və yanındakılardan görərdilər. Agah olun ki, onların başına gələn*** *(bəla və müsibətlər)* ***Allahdandır…».*** *(əl-Əraf 131).* ***«Onlara bir xeyir yetişdikdə bu Allahdandır deyərlər. Bir pislik üz verdikdə isə bu səndəndir söyləyirlər. Onlara de ki: «Hamısı Allah tərəfindəndir». Bu camaata nə olub ki, az qala söz də anlamır!*** *(Ey insan!)* ***sənə yetişən hər bir yaxşılıq Allahdandır, sənə üz verən hər bir pislik isə özündəndir…».*** *(ən-Nisa 78-79).* ***Onlara de ki: «Hamısı Allah tərəfindəndir»*** buyuruğu o, deməkdir ki, bolluq, qıtlıq, zəfər və yenmək hamısı Allah tərəfindəndir. ***«Sənə üz verən hər bir pislik isə özündəndir»*** buyuruğu isə sənə nisbət edilən Allahdan gələn hər bir pislik sənin etdiyin günah səbəbilə sənə verilən cəzadır. ***«Sizə üz verən hər bir müsibət öz əllərinizlə qazandığınız günahların ucbatındandır».*** *(əş-Şura 30).* İbn Abbas - *radıyallahu anhu* –deyir ki, sənin başına gələn hər bir pislik sənin özündəndir. Çünki yaxşılıq Uca Allaha izafə edilir. Çünki hər bir baxımdanda bu yaxşılığı ehsan edən Odur. Hansı tərəfdən baxılırsa-baxılsın yaxşılığın mütləq ona izafə edilməsi lazımdır. Pisliyə gəlincə isə O, pisliyi ancaq bir hikmət olaraq yaradır. Çünki Uca Allah əsla heç bir pislik etməz. Əksinə Onun bütün əməlləri (felləri) xeyirdir və gözəldir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* –də istiftah duasında buyurur ki, xeyir bütünlüklə sənin əlindədir, pislik (şər) isə Sənə aid deyildir. Yəni Sən bir pislik və şər yaratmazsan. Əksinə bütün yaratdıqlarında bir hikmət vardır. O, hikmət etibarı ilə şər kimi görünən bir xeyirdir. Ancaq bəzi insanlar üçün onda bir şər ola bilər. Bu isə cüzi bir şərdir. Külli və mütləq bir şər yaratmaqdan isə Şanı Uca Allah münəzzəhdir. Belə bir şər ona nisbət edilə bilməz. Əksinə Ona nisbət edilən hər şey xeyirdir.

***Xeyir –*** insanın mənfəətləndiyi hər bir xeyirli elm, ailə, var-dövlət və s.

***Şər –*** bunun əksi olaraq xəstəlik, cahillik, kasıblıq, ailənin dağılması.

Allah xeyiri hansısa bir hikmətə görə təqdir edir. Həmçinin şərridə. İnsanın nəzərində şər olan bir əməlin arxasında böyük bir xeyir, hikmət vardır. ***«İnsanlar öz əlləri ilə etdikləri pis əməllər*** *(öz günahları)* ***üzündən suda və quruda fəsad, pozuntu əmələ gələr*** *(bəzi yerlərdə quraqlıq, qıtlıq olar, bəzilərində zərərli yağışlar yağar, zəlzələ baş verər, dənizlərdə gəmilər batar)* ***ki, Allah*** *(bununla)* ***onlara etdikləri bəzi günahların cəzasını daddırsın və bəlkə onlar*** *(tövbə edib pis yoldan)* ***qayıtsınlar».*** *(ər-Rum 41).* ***«Əgər o, məmləkətlərin əhalisi iman gətirib*** *(pis əməllərdən)* ***çəkinsəydilər,***

---

[1652] Suyuti «Durrul Mənsur» 2/185.
[1653] Namaza giriş təkbirindən sonra edilən dua.
[1654] Müslim 771, Əbu Davud 760, Tirmizi 3422, Nəsai 2/130.

***sözsüz ki, onların başlarına göydən və yerdən bərəkət yağdırardıq** (göyün və yerin bərəkət qapılarını onların üzünə açardıq). **Lakin onlar** (öz Peyğəmbərlərini) **yalançı hesab etdilər, Biz də onları qazandıqları günahlara görə məhv etdik».** (əl-Əraf 96). **«Bu** (dünyada) **öz əllərinlə etdiyin günahların cəzasıdır, yoxsa Allah bəndələrinə əsla zülm edən deyildir».** (əl-Həcc 10).* Mucahid – *rahmətullahi aleyhi* – deyir ki, əgər hər hansı bir zalım yer üzərində zülümkarlıq edərsə Allah onun günahı ucundan yağışı saxlayar, meyvələr barını verməz, günahlar çoxaldıqca Allah da öz dərgahında əzabı çoxaldar. Günahların çoxalmasından günəşin tutulması, zəlzələlər və yer üzündən bərəkətin qalxması olur. Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – hicrət vaxtı üzünü bizə tərəf çevirib buyurdu: «Ey hicrət edənlər 5 şey vardır ki, ondan Allaha sığının. 1) Hər hansı bir qövmdə zinakarlıq açıq-aydın yayılarsa Allah onları taunla və başqa xəstəliklə cəzalandırar ki, bundan qabaq bu xəstəlik haqqında eşitməyiblər. 2) Hər hansı qövmdə çəkidə və ölçüdə aldadarlarsa Allah da onları aclıqla və qəddar sultanla sınağa çəkər. 3) Hər hansı bir qövmdə zəkat verilməzsə Allah da onları quraqlıqla sınağa cəkər və əgər heyvanlar olmasaydı onlara heç yağış da yağmazdı. 4) Hər hansı bir qövm Allahla əhdini pozarsa Allah da onların üzərinə düşmənlərini salar və əllərində olan şeyləri də onlardan alarlar. 5) Hər hansı bir qövmün (əmirləri) Allahın hökm etdiyi ilə əməl etməzlərsə Allah da onları zəlil edər (aralarında düşmənçilik salar)». Abdullah b. Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə birlikdə Səmud qövmünün ərazisi olan Hicr ərazisinə gəldik. Oranın quyularından su aldıq və xəmir yoğurduq. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – aldığımız suları boşaltmağımızı və yoğurduğumuz xəmirləri isə dəvələrə yedirtməyimizi əmr etdi. Peyğəmbər: «Ağlayanlar müstəsna olmaqla (ağlamayanlar) nəbadə əzaba uğramış olan bu qövmün yurduna girsinlər. Əgər ağlamasanız onlara toxunan əzabın bir bənzəri sizlərə də toxunmasından qorunmaq üçün onların yurdlarına girməyin. Sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – vaxtılə Saleh – *əleyhissəlam* – ın dişi dəvəsinin su içdiyi quyudan su almalarını onlara əmr etdi».

Şərrin özü Allaha nisbət edilmir. Yəni Allah şər etmir. Əgər o, şərdə heç bir xeyir yoxdursa o, Allaha aid edilmir. Allahı təqdir etdiyi şərrin sonu xeyirlə, böyük hikmətlə olur. O, işin sonunda xeyir yoxdursa şərdirsə o, Allaha nisbət edilmir. Ola bilər ki, şər hansısa müəyyən bir insanlar üçün şər olsun. Lakin ümumi cəmaat üçün görürsən ki, xeyirdir. Məs: Allah İblisi yaradıb öz bəndələrini imtahana çəkmək üçün. İblis şərdir. Bəndələrinin bir qismi onu özünə düşmən tutar, bir qismi isə dost tutar. Həmçinin zinakarın daş-qalaq edilməsi, oğrunun əlinin kəsilməsi şərdir. Lakin onlar üçün xeyirdi çünki günahlarına kəffarədir. İkinci tərəfdən isə oğrunun cəzalandırılması insanların mallarının qorunması deməkdir, zinakarın daş-qalaq olunması qeyrət-namusun qorunması deməkdir. Həmçinin Allah güclü leysan yağış yağdırır. Bu yağış kimlərəsə ziyan olduğu halda, görürsən ki, hansısa bir kəndin cəmaatı çoxdan bəri idi ki, belə bir yağışı öz əkin sahələri üçün gözləyirdilər. Görürsən ki, zəlzələlərdən sonra bir çox insanlar tövbə edirlər, bədbəxt hadisələrdən sonra insanların bir çoxları qəflətdən

---

[1655] İbn Məcə, İmam Əhməd, əl-Albani «Səhih Silsilə» 106.

[1656] Müslim 2980 – ***Hicr*** – Mədinə ilə Şam arasında bir vadinin adıdır. Bura Saleh – *əleyhissəlam* – ın qövmü olan Səmudun mərkəzi idi. Allah bu qövmü Peyğəmbərinə itaət etmədiklərinə görə məhv etmişdir. Tarixçilər Səmudu Nuh – *əleyhissəlam* – ın nəslindən sayırlar. Səmud b. Cabir b. İram b. Şam b. Nuh. Saleh – *əleyhissəlam* – İbrahim – *əleyhissəlam* – dan əvvəl yaşamışdır. Quran surələrinin adlarından da biri əl-Hicr surəsidir. Maraqlananlar bu surəyə baxa bilərlər.

ayılaraq tövbə edib xeyirli işlər görməyə başlayırlar və s. İkinci tərəfdən də o şər ki, Allah onu təqdir edir o, insan üçün xeyirlidir. Əgər insan səbr edib əcrini Allahdan diləyərsə, o şər sənin doğru yolu tapmağına, Allahın sənə verdiyi nemətin qədrini bilməyə səbəb olur. İnsan xəstələndikdə, kasıbladıqda digər xəstə insanların, kasıbların nələr çəkdiyini də fikirləşir. Bu da Allaha şükr etməyi yaradır. ***«Biz bilmirik ki, yerdə olanlara bir pislik etmək istənilmişdir, yoxsa Rəbbi onlara bir xeyir diləmişdir».*** *(əl-Cinn 10).* Bu ayədə xeyir Allaha, şər isə Ona izafə edilməmişdir. Allahın rəhmətinin və hikmətinin kamilliyindən şər Ona izafə edilməz. Ona görə də deyilir ki: "Allahın Qadasında şə yoxdur, şər yalnız Qədərdə və Məqdidədir". ***«Əgər siz şükr etsəniz və iman gətirsəniz sizə əzab vermək Allahın nəyinə lazımdır? Allah şükrə qiymət verən və hər şeyi Biləndir!».*** *(ən-Nisa 147).* ***«Əgər Allaha ibadət edirsinizsə Onun nemətinə şükr edin!».*** *(ən-Nəhl 114).* ***«Allah sizi analarınızın bətnlərindən heç bir şey bilmədiyiniz*** *(dərk etmədiyiniz)* ***halda çıxartdı. Sonra sizə qulaq, göz və qəlb verdi ki, bəlkə şükr edəsiniz!»*** *(ən-Nəhl 78).* ***«Əgər şükr etsəniz sizin şükrünüz Ona xoş gələr. Heç bir günahkar başqasının günahını daşımaz…».*** *(əz-Zumər 7).* ***«Biz ona haqq yolu göstərdik. İstər*** *(nemətlərimizə)* ***minnətdar olsun, istər nankor».*** *(Dəhr 3).* ***«****(Ya Peyğəmbər!)* ***De ki: «Sizi yoxdan yaradan, sizə qulaq, göz və qəlb verən Odur.*** *(Allahın nemətlərinə)* ***nə az şükr edirsiniz!»*** *(əl-Mulk 23).* ***«****(Ey Camaatım!)* ***Yadınıza salın ki, o, zaman Rabbiniz bunu bildirmişdir. Əgər Mənə şükr etsəniz sizə olan nemətimi artıracağam. Yox əgər nankorluq etsəniz,*** *(unutmayın ki,)* ***Mənim əzabım həqiqətən şiddətlidir!».*** *(İbrahim 7).*

Şər Allahın felində (əməllərində) deyildir. O, şərri və ya xeyiri də yaratdıqlarının əməllərində edir. ***«Yaratdıqlarının*** *(insanların, cinlərin, vəhşi heyvanların)* ***şərrindən».*** *(əl-Fələq 2).* Allah – *subhənəhu və təalə* – nin əməli (feli) xeyirdir və heç kəsə əsla zülm etməz. Uca Allah zülümdən münəzzəhdir. O, ədalət sifətinə sahibdir. Kimsəyə zərrə ağırlığında zülm etməz. Onun bütün əməlləri ədalətdir və rəhmdir. ***«****(Ey insan!)* ***sənə yetişən hər bir yaxşılıq Allahdandır…».*** *(ən-Nisa 79).* Allah – *subhənəhu və təalə* – əsla heç kəsə zülm etməz. Əksinə Allah ədalətlidir. Buna Quran və Sünnədən bir çox dəlilləri misal gətirmək olar. ***«Malınızdan verdiyiniz hər hansı bir şeyin əvəzi tamamilə sizə ödəniləcəkdir. Sizə əsla zülm edilməz».*** *(əl-Bəqərə 272).* ***«Allah onlara zülm etmədi, lakin onlar öz özlərinə zülm etdilər».*** *(Ali-İmran 117).* ***«Bu əzab sizin öz əllərinizlə törətdiyiniz işlərə görədir, yoxsa Allah bəndələrinə əsla zülm edən deyildir».*** *(Ali-İmran 182).* ***«Sizə xurma çərdəyində olan nazik tel qədər belə zülm olunmayacaqdır».*** *(ən-Nisa 77).* ***«İnsanlar arasında ədalətlə hökm olunar, onlara***

---

[1657] ***Zülm –*** hər hansı bir şeyi qoyulması lazım olan yerdən başqa bir yerə qoymaqdır. Zülm üç növdür. 1) Allaha qarşı olan zülmdür – ***«****(Ya Muhəmməd!)* ***Yadında olsun ki, bir zaman Loğman öz oğluna nəsihət edərək belə demişdir: «Oğlum! Allaha şərik qoşma. Doğurdan da Allaha şərik qoşmaq ən böyük zülmdür».*** *(Loğman 13).* 2) İnsanlara qarşı olan zülm. 3) İnsanın özü özünə etdiyi zülm. Cabir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Zülmdən çəkinin, çünki zülm qiyamət günü zülmətdir» Müslim şərhi 5/441. Əbu Umamə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ümmətimdən iki sinif vardır ki, mənim şəfaətimə əsla nail olmayacaqdır. Zalım və gözü zülmdən başqa bir şey görməyən başçı ilə haqdan uzaqlaşan və oğurluq edən hər kəs» Səhih Cəmi 3692. Əbu Musa - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah zalıma möhlət verər. Nəhayət onu yaxaladımı artıq buraxmaz» Buxari 5/214, Müslim şərhi 5/444. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qardaşınız istər zalım olsun, istərsə də məzlum ona yardım edin». Səhabələrdən: «Ey Allahın Rəsulu! Məzluma yardım etdik, zalıma necə yardım edək?» deyə soruduar. Peyğəmbər: «Onu zülm etməkdən çəkindirməkdir» Buxari 3/98. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnsanlar zalımı görüb onun əllərini zülmdən çəkməzlərsə (Başqa rəvayətdə: «Yaxşılığı əmr edib pislikdən çəkindirməzlərsə») aradan çox vaxt keçməz ki, Allah onları bir cəza ilə hamısını məhv edər (Başqa rəvayətdə: «Sonra ona dua etsəniz də O, sizin duanızı qəbul etməz»)» Səhihul Cəmi 1969, 6947.

***zülm edilməz».*** *(Yunus 54).* ***«Onlar heç bir zülm, haqsızlıq görmədən Cənnətə daxil olacaqlar».*** *(Məryəm 60).* ***«Bu gün heç kəsə heç bir zülm edilməyəcəkdir. Siz ancaq etdiyiniz əməllərin cəzasını çəkəcəksiniz».*** *(Yasin 54)* . Əbu Zərr əl-Ğifari - *radıyallahu anhu* – , Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Uca və Böyük olan Allahdan belə buyurmuşdu: «Ey mənim qullarım! Mən zülümü özümə haram etdim. Onu sizin aranızda da haram edirəm. Buna görə də bir-birinizə zülm etməyin» . İbn Abbas, Ubadə b. Samit və Zeyd b. Sabit – *Allah Onlardan Razı Olsun* - yolu ilə gələn rəvayətdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Heç şübhəsiz ki, əgər Allah aləmlərdə olan hər bir şeyi cəzalandırmaq istəsə onlara zülm etmədən cəzalandırar. Əgər onlara rəhmət diləməli olsa əlbətdəki Onun rəhməti onlar üçün öz əməllərindən də xeyirli olar» . İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Hüneyn günü hərbdən sonra qənimətləri bölüşdürdükdə bəzi inanları bu bölüşdə üstün tutdu. Əqra b. Xabisa yüz dəvə verdi, Uyeynə (b. Hisnu) də bu qədərini verdi. Ərəb aşrəflərindən bəzilərinə də bu sayda dəvə verərək başqalarından üstün etdi. (Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in bu işinə) bir nəfər etiraz edərək dedi: «Vallahi bu bölüm ədalətli olmadı və Allah – *subhənəhu və təalə* – nin razılığı bu işdə gözlənilmədi». İbn Məsud: «Vallahi! Mən bu sözləri Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə çatdıracağam dedim. Və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə gedib eşitdiklərimi ona xəbər verdim». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in üzü dəyişdi. Qıpqırmızı boya kimi oldu. Əgər Allah və Rəsulu da ədalətli olmasa onda kim ədalətli ola bilər! deyə buyurdu. Sonra da: «Allah Musa – *əleyhissəlam* – a rəhmət eləsin. O, bundan da əziyyətli sözlərlə qarşılaşdı lakin səbr etdi . ***«De ki: «Allah ədaləti əmr etdi…».*** *(əl-Əraf 29).*

## ALLAH – *Subhənəhu Və Təalə* – NİN QƏDƏRİ İLƏ RAZILAŞMAQ

Allahın istədiyi hər bir şey baş verir, istəmədiyi isə olmur. Yerlərdə və göylərdə Allahın istədiyindən kənarda heç bir şey baş vermir. Baş verən hər bir şey də Allahın hikmətinə uyğundur. Allah istədiyinə hidayət verir öz rəhməti və fəzilətilə. İstədiyini də zəlalətə salır öz hikmətilə. Allahın istədiyindən başqa heç bir şey baş vermir. Hər bir şey Allahın istəyi və iradəsilədir. Kiminsə mömin və kimnsə kafir olması Allahın istəməsilədir. Allahın istəyi olmasa bir yarpaq belə ağacdan düşə bilməz. Allah etdiyi heç bir şey haqqında soruşulmaz, lakin insanlar isə soruşulacaqlar. Allahın istədiyi kimsələrdən başqa heç kəs iman gətirə bilməz. Müşriklər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in möcüzələrini görürdülər. Lakin yenə də iman gətirmirdilər. Bütün kainatda baş verən hər bir şey istər Allahın felləri olsun, istər insanların felləri Allahın istəyi ilə olur. Allah yaradır öz istəyilə, gecənin 3/1 göy səmasına enir öz istəyilə, rəhm edir öz istəyilə, gülür, qəzəblənir öz istəyilə. Məxluqatların istəyi də Allahın istəyilədir. Məscidə getməyimiz, məsciddə toplanmağımız və s. Allahın istəyilədir. Allahın istədiyi bir şey baş verməyə bilməz. Baş verməyən şey isə ona görə baş vermir ki,

---

[1658] Həmçinin Bəqərə 279,281, Nisa 40,49,124, Ənam 160, Ənfal 51, Tövbə 70, Yunus 44,47, Hud 101, Nəhl 33,111,118, İsra 71, Məryəm 60, Ənbiya 47, Həcc 10, Muminun 62, Ənkəbut 40, Rum 9, Yasin 54, Kəhf 49, Zumər 69, Zuxruf 76, Casiyə 22, Əhqaf 19, Qaf 29, Fussilət 46 və s. ayələr dəlildir ki, Allah zülm edən deyildir.
[1659] Müslim 2577, Əhməd «Musnəd 5/160.
[1660] Əbu Davud 4699, İbn Məcə 77.
[1661] Buxari 3150, Müslim 1061.

Allah istəmir. ***«Əgər Allah istəsəydi onlar müşrik olmazdılar. Biz səni onların üzərində gözətçi qoymamışıq və sən onların vəkili də deyilsən».*** *(əl-Ənam 107).* ***«Allah istəsəydi onları doğru yola yığardı».*** *(əl-Ənam 35).*

İnsan hər hansısa bir şeyi düzəldir, Allahın istəyi, iradəsi altında. Bizim özümüzü də, əməllərimizi də Allah yaratmışdır. Bütün hərəkət edənləri və hərəkətlərinidə, hər bir yerində duran və onun sükunətdə durmasını da Allah yaratmışdır. Bununla yanaşı Allah insana qüdrət və ixtiyar vermişdir ki, insan da bununla hərəkət edir. İnsan hidayəti də, zəlaləti də öz ixtiyarı ilə seçir. Heç şübhəsiz ki, Allah öncədən bilirdi sən kim olacaqsan. Sən bu yolu öz ixtiyarınla seçmisən. Firon kafir idi. Allah bunu bilirdi. Lakin buna baxmayaraq ona dəvətçilərini göndərir ki, onunla yumşaq danışaraq ona haqqı bəyan etsinlər. ***«Fironun yanına yollanın. O,*** *(Allahlıq iddiasına düşməklə)* ***həqiqətən azğınlaşıb həddini azmışdır. Onunla yumşaq danışın. Bəlkə öyüd-nəsihət qəbul etsin, yaxud*** *(Rəbbindən)* ***qorxsun»*** *(Ta ha 43-44).* Hər bir şey Lövhi Məhfuzdakı kimi olacaqdır. Allah əzəli elmi ilə hər bir şeyi bilir və hər bir şeydən də xəbərdardır. Allahın elmi nə artır, nə də azalır. Allah bilir ki, yaratdıqdan sonra kim necə olacaqdır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah Zəkəriyyə oğlu Yəhyə - *əleyhissəlam* - anasının bətnində ikən mömin olaraq yaratmışdı, Fironu isə anasının bətnində ikən kafir olaraq yaratmışdır"[1662].

Allahın Qədəri ilə razılaşmaq hər bir müsəlmana vacibdir. Çünki qədər ilə razılaşmaq Allahın Rububiyyəti ilə razılaşmağın kamilliyin-dəndir. Kim qədər ilə razılaşarsa deməli o, kimsə Allahın Rububiyyətilə razıdır. Allah Qada edir. ***Qada*** Allahın felidir. ***Məqdi*** – isə baş vermiş deməkdir. Qada ilə hər bir mömin razı qalmalıdır. Qadaya qarşı çıxmaq olmaz. Məqdinin isə təfsilatına varmaq lazımdır. Çünki məqdinin bir neçə növü vardır.

1. Onunla insanın razı qalması vacibdir. Bu da Allahın bizə şəriət etdiyi əmrlərilə və qadağaları ilə razı qalmaqdır. Burada həm qada tərəfdən razı qalmaq lazımdır, həmçinin də məqdi tərəfdən də razı qalmaq lazımdır.

2. Haramdır onunla razı qalmaq. Günahlar, asiliklər və s. Zinakarın zina etməsi, oğrunun oğurluq etməsi, şərik qoşanın şirki və s. Bununla razı qalmaq olmaz. Qada tərəfdən razıyıq. Çünki Allah bunu belə təqdir edib. Lakin məqdi tərəfdən isə biz razı deyilik, inkar edirik və aradan qaldırmaq üçün çalışırıq. Allah bu işi Qada etməklə yanaşı bu işi sevmir və razı da deyildir. Nə üçün biz Qadadan razı qalmalıyıq? Çünki bu Allahın hikmətindəndir və qədərindəndir. Nə üçün inkar etməliyik? Çünki Allhın xoşuna gəlmir.

3. Müstəhəbdir onunla razı qalmaq. Onlarla razı qalmaq müstəhəb, səbr etmək isə vacibdir. Bunlarda Allahın göndərdiyi müsibətlər və bəlalardır. İnsana vacibdir ki, başına gələnlərə səbr etsin, razı qalmaq isə bu məsələdə müstəhəbdir. Məs: Zəlzələ nəticəsində yaxınlarını itirir. Bu Allahın göndərdiyi müsibətdir. Buna səbr etməsi vacibdir. Çünki Allahın qədəri belə idi. Razı qalması isə müstəhəbdir. Lakin yaxşıdır ki, insan Allahın Qadası ilə razı qalsın. Bu da imanın kamilliyi və əcrin qazanılmasıdır. Əbu Səid əl-Xudri və Əbu Hureyrə - *radıyallahu anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mömini nə yorğunluq, nə xəstəlik, nə əzab-əziyyət, nə rahatsızlıq, nə kədər, nə də bədəninə batan tikan maraqlandırır. Onu maraqlandıran Allahın bunlara səbr etdiyinə görə günahlarını təmizləməsidir» .

---

[1662] İbn Adi "Kamilə", Təbərani "Mucəmul Vasit", əl-Albani "Səhih Cəmi" 3232.
[1663] Buxari, Müslim.

***Səbr Və Rıda Arasında Fərq***:

***Səbr*** **-** İnsan səbr edir o, işlərə ki, onları sevmir və onlardan xoşlanmır. Həmən şeyin (həmən anda) baş verməsini sevmir. Eyni zamanda insan şəriətə və səbrə zidd olan heç bir şey də etmir. Səbr edir Allahın razılığını qazanmaq və Allahın əmri olduğu üçün. Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, bir gün Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – oğlunun qəbri üzərində duraraq ağlayan bir qadının yanından keçirdi. Peyğəmbər: «Allahdan qorx və səbrli ol!» deyə buyurdu. Qadın Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – i tanımadığı üçün: «Ged başımdan! Sən mənim dərdimi bilməzsən» dedi. Qadına: «O, şəxs Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – idi deyildikdə dərhal onun ardıyca qapısına gəldi». Lakin qapı önündə (zənn etdiyi) kimi qapıçılara rast gəlmədi. Qadın: «Sizi tanımamışdım (üzr istəyirəm)» dedikdə Peyğəmbər: «Həqiqi səbr müsibətin ilk anında olur» deyə buyurdu .

***Rıda*** **–** İnsanın bir işə ikrah etməməsi, razı qalmasıdır. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki, bəndənin başına gələnlər iki halda ola bilər: «Əməli etməzdən özncə ona lazımdır ki, Allahdan kömək diləsin, Allaha təvəkkül etsin və dua etsin. Əgər hadisə onun heç bir feli olmadan baş verərsə səbr etsin və razı qalsın. Əgər əməl insanın öz istəyi ilə baş verərsə yaxşı əməldirsə (nemətdirsə) Allaha həmd etsin, yox əgər günahdırsa Allahdan bağışlanma diləsin». Namaza başlamamışdan əvvəl Allaha yönəl, Allahdan kömək və əcr dilə. Namazı bitirdikdən sonra bağışlanma dilə. Əstəğfirullah de və Allaha həmd et bu ibadəti yerinə yetirdiyinə görə. ***«Səbr et. Günahının bağışlanmasını dilə. Axşam-səhər Rəbbini həmd-səna ilə təqdis et!».*** *(əl-Mumin 55).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* –buyurdu: «Allah güclü mömini zəif mömindən daha çox sevir. Hər bir işdə özünə faydalı olanı götürməyə səy göstər. Allahdan kömək dilə aciz olma. Başına bir müsibət gələrsə demə: «Əgər belə etsəydim belə olmazdı» De ki: «Allahın qəza və qədəri bu imiş. Əgər sözü şeytana yol açır» .

## BƏNDƏLƏRİN ƏMƏLLƏRİ

Quran və Sünnə bəyan etmişdir ki, bəndələrin əməlləri məxluqdur. Həmçinin Allah tərəfindən bu əməllər yazılmışdır və Allahın qədərindən kənarda da deyildir. Allah bilirdi ki, nə yaradacaq və onlar da nə edəcəklər. Bütün bunları da Lövhi Məhfuzda yazmışdır. Allahın qədəri öncədən onlar üçün yazılmışdır və onlar da həmən qədər üzərə hərəkət edirlər. Allah kimin qədərində səadət, xoşbəxtçilik yazıbsa həmən insan haqqa hidayət edir, kimin üçünsə bədbəxtçilik yazılıbsa o, da zəlalətə düçar olur. Allah Cənnət əhlinin öncədən bilir və onlar üçün Cənnət əhlinin əməllərini asantlaşdırıb və həmçinin də Allah Cəhənnəm əhlini də bilir və onlar üçün də Cəhənnəm əməllərini yaradıb. ***«Halbuki sizi də, sizin düzəltdiklərinizi də Allah yaratmışdır».*** *(əs-Saffət 96).* ***«Allahın doğru yola yönəltdiyi şəxs doğru yolda olan,*** *(haqq yoldan)* ***azdırdığı şəxslər isə ziyana uğrayanlardır».*** *(əl-Əraf 178). "(Ya Rəsulum!)* ***İnsanları hikmətlə*** *(Quranla, tutarlı dəlillərlə),* ***gözəl öyüd-nəsihət*** *(moizə)* ***ilə Rəbbinin yoluna*** *(İslama)* ***dəvət et, onlarla ən gözəl surətdə*** *(şirin dillə, mehribanlıqla, əqli səviyyələrinə müvafiq şəkildə)* ***mübahisə et. Həqiqətən, Rəbbin yolundan azanları da, doğru yolda olanları da daha yaxşı tanıyır!".*** *(ən-Nəhl 125).* ***"Onların etdiyi hər şey*** *(əməllərinin yazıldığı)*

---

[1664] Buxari 1283, Müslim 926.
[1665] Buxari, Müslim.

***dəftərlərdədir!".*** *(Qəmər 52).* Bura qədər sadaladıqlarımız onu göstərir ki, bütün fellər Allah tərəfindən yaradılmışdır.

***«Bu sizin*** *(dünyada)* ***etdiyiniz yaxşı əməllər müqabilində varis olduğunuz Cənnətdi!».*** *(əz-Zuxruf 72). Bu ayə insanın ixtiyar və iradə sahibi olduğunu göstərir.* ***«Haqq Rəbbinizdəndir. Kim istəyirsə inansın, kim də istəyir inanmasın…».*** *(əl-Kəhf 29).* Mömin də, kafir də ixtiyar sahibidirlər. Allah insana ağıl verib, qüdrət verib, pis və yaxşı yolu da göstərib, Cənnətə və Cəhənnəmə aparan əməlləri də göstərib ki, insan seçsin. ***«Etdiyiniz əməllərin cəzası olaraq dadın əbədi əzabı».*** *(əs-Səcdə 14).* ***«****(Ey möminlər!)* ***Qadınlarınız sizin*** *(övlad əkdiyiniz)* ***tarlanızdır. İstədiyiniz vaxtda öz tarlanıza gəlin».*** *(əl-Bəqərə 223).* İnsan ixtiyar sahibidir yaxınlaşmağın formasında. Həmçinin Sünnədən də dəlillər bizlərə bəyan edir ki, insana əməl etmək və ya etməmək qadağan olunmayıb. Çünki insan Allahın onun qədərində nə yazdığını bilməz. Buna görə də Allaha təvəkkül edərək buyrulan işləri etməli, səadət yolunu tutmalı və bu səadətə çatmaq üçün Allahın razı qaldığı səbəblərdən tutmalıdır. Əli - *radıyallahu anhu –* rəvayət edir ki, Rəsulullah *– sallallahu aleyhi və səlləm –* buyurdu: «Sizdən heç bir kimsə və yaradılmışlardan heç bir nəfs müstəsna olmaq üzərə şübhəsiz ki, Cənnətdəki və Cəhənnəmdəki yerini Allah yazmış (təqdir və təyin) etmişdir. Hər kəsin xoşbəxt və ya bədbəxt olduğu şübhəsiz ki, yazılmışdır». Səhabələrdən biri: «Ya Rəsulallah! O, halda nə üçün əməl edib çalışırıq? Hər şey bilindiyi halda (əməlin faydası nədir?) dedi. Peyğəmbər: «Xoşbəxt olanlardan olan kimsə, xoşbəxt kimsələrin əməli ilə əməl edəcəkdir. Bədbəxt olanlar da, bədbəxt olan kimsələrin əməli ilə əməl edəcəkdir. Xeyr, siz o bilinmiş olan yazıya görə dayanmayın, əməl edib çalışın. Çünki hər kəs nə üçün yaradılıbsa o da onun üçün asantlaşdırılacaqdır. Xoşbəxt olan kimsələrə, xoşbəxt kimsələrin əməllərini etmək asantlaşdırılacaqdır. Bədbəxt olan kimsələrə də, bədbəxt olan kimsələrin əməlini etmək asantlaşdırılacaqdır». Sonra bu ayəni oxudu: ***«Kim*** *(malını Allah yolunda)* ***versə,*** *(Allahdan)* ***qorxsa və ən gözəl sözü təsdiq etsə biz ona Cənnəti müyəssər edəcəyik. Amma kim*** *(malını Allah yolunda xərcləməyə)* ***xəsislik etsə,*** *(mal-dövlətinə güvənib Allaha)* ***möhtac olmadığını sansa və ən gözəl sözü yalan saysa biz onu Cəhənnəm üçün hazırlayacağıq»*** *(əl-Leyl 5-10)* . İmran b. Hüseyn - *radıyallahu anhu –* rəvayət edir ki: «Bir nəfər Ya Rəsulullah! Cənnət əhli atəş əhlindən (ayırd edilib) bilindi mi?» deyə soruşdu. Peyğəmbər: «Bəli, (ayırd edilib bilinmişdir) deyə buyurdu. Həmən şəxs: «Elə isə (yəni Cənnətlik, Cəhənnəmlik əzəldən bəri bəlli olduğu halda) çalışıb əməl edənlər nəyə əməl edirlər?» dedi. Peyğəmbər: «Hər kəs nə üçün yaradıl-mışsa onun yolları onun üçün asantlaşdırılacaqdır» deyə buyurdu . Ömər b. Xattab - *radıyallahu anhu –* deyir ki: "Ya Rəsulullah! Bizim etdiyimiz əməmllər indi təqdir edilir, yoxsa artıq təqdir edilmişdir?". Peyğəmbər: "Hər bir şey artıq təqdir edilmişdir. Ey Xattabın oğlu (sənədə), digərlərinə də onun yolu asanlaşdırılacaqdır. Kim xoşbəxtlər içərisində olarsa, o öz xoşbəxtçiliyi üçün çalışır. Kim də bədbəxtlər içərisində olarsa, o da öz bədbəxtçiliyi üçün çalışır"[1668]. Amr b. As - *radıyallahu anhu –* rəvayət edir ki, bir gün Rəsulullah *– sallallahu aleyhi və səlləm –* əlində iki kitab olduğu halda yanımıza gəldi və buyurdu: «Bilirsinizmi bu nə kitabdır?". Biz: "Xeyr, Ya Rəsulullah" dedik. O, sağ əlində olan kitaba işarə edərək: "Bu aləmlərin Rəbbinin kitabıdır və orada Cənnət

---

[1666] Buxari, Müslim 2647,2648.

[1667] Buxari, Müslim.

[1668] Tirmizi 2135, əl-Albani "Səhih".

əhlinin adları, atalarının adlar və (mənsub olduqları) qəbilənin (millətin) adı vardır. Sonuncu ad ilə yekun verilib və bundan sonra ora nə əlavə ediləcəkdir, nə də oradan çıxarılacaqdır". Sonra o, sol əlində olan kitaba işarə edərək: "Bu aləmlərin Rəbbinin kitabıdır və orada Cəhənnəm əhlinin adları, atalarının adlar və (mənsub olduqları) qəbilənin (millətin) adı vardır. Sonuncu ad ilə yekun verilib və bundan sonra ora nə əlavə ediləcəkdir, nə də oradan çıxarılacaqdır". Səhabələr: "Bəs onda əməl nəyə lazımdır Ya Rəsulullah! Artıq hər bir yazılmışdır" dedilər. Peyğəmbər: "Doğru əməl edin və yaxınlaşın. Kim Cənnətə düşərsə ömrünü Cənnət əhlinin əməli ilə son verər öncədən nə etməsinə baxmayaraq, kim də Cəhənnəmə düşərsə ömrünü Cəhənnəm əhlinin əməli ilə son verər öncədən nə etməsinə baxmayaraq". Sonra Rəsulullah – *sallallahu aleyhi və səlləm* – əlini açaraq sanki (kitabları) tullamaq istədi və buyurdu: "Sizin Rəbbiniz qulları ilə (məsələni) həll etdi. Kimiləri Cənnətə, kimiləri də Cəhənnəmə düşəcəkdir"[1669].

Hafiz əl-Həkəmi – *rahmətullahi aleyhi* – deyir ki: «Bəndələrin bu əməlləri etmək üçün istəyi və qüdrəti vardır. Allah insanları və onların qüdrətlərini və istəklərini də yaradandır. Həmçinin onların sözlərini və əməllərini də yaradandır. Allah özü bunu insanlara vermiş və qədərdə də təqdir etmişdir. Bu əməllərinə görə cəza və əcr qazanmağı da onlar üçün təqdir etmişdir. Allah insanlara onların gücləri çatmayacaqları və daşıya bilməyəcəkləri şeylərlə yükləməmişdir. Allah onlara xəbər vermişdir ki, onlar Allahın onlar üçün təqdir etdiyindən başqasına da nail ola bilməzlər. Allahın istədiyindən başqa da bir şey istəyə bilməzlər. Allah insanların istəyini, məşiətini, əməllərini, qüdrətini də öz istəyi, məşiəti, qüdrəti və iradəsi daxilində etmişdir. Allahın istəyi, iradəsi, qüdrətindən kənarda deyildir. Bununla bərabər insanın istəyi, qüdrəti, iradəsi Allahın istəyi, iradəsi, qüdrəti deyildir. Necə ki, insan Allahın özü deyildir. İnsan məxluqdur, Allah isə yox. Qüdrət, istək, iradə bunlar yalnız adlarda bir-birinə bənzəyirlər. Lakin həqiətdə isə Allahın qüdrəti, istəyi, iradəsi özünə məxsus şəkildə, insanın isə özünə məxsus şəkildədir.

Feli edən həqiqətən də bəndədir, felə hidayət edən isə həqiqətən də Allahdır. Hidayət edən Allah, hidayət olunan isə bəndədir. ***«Sizi yaradan Odur. Kiminiz kafirsiniz, kiminiz mömin. Allah nə etdiklərinizi görən-dir».*** *(ət-Təğabun 2).* Kim hidayətə layiqdirsə hidayət olunacaqdır. Kim də hidayətə layiq deyilsə əməlləri ilə zəlaləti qazanacaqdır. Allah şəri olaraq istəyir hamının hidayət olunmasını. Lakin kovni olaraq istəmir. Allah insanları yaradıb və onların əməl etmələri üçün qadağalar və əmrlər qoymuşdur. Kim ki, əməli və əməl etməyi də insana izafə (xas) edərsə artıq küfr etmiş olar. Çünki bu Qədəriyyə firqəsinin sözüdür ki, onlar həm əməli, həm də əməli etməyi insana izafə edirlər. İnsan öz əməlini özü yaradır və edir. Allah öncədən onun nə əməl edəcəyini bilmir. Əməl etdikdən sonra bilir. Həmçinin kim hər iki əməli Allaha izafə edərsə yenə də küfr etmiş olar. Bu da Qədəriyyənin bir qolu olan Cəbərilərin fikridir ki, onlar deyirlər: «İnsan əməlləri etməyə məcburdur, onun heç bir seçimi və ixtiyarı yoxdur». Əhli Sünnə vəl Cəmaat deyir ki: «Hidayət edən Allahdır, hidayət olunan isə insandır. Kim feli Allaha, feli yerinə yetirməyi isə insana izafə edərsə o, həqiqi mömindir».

---

[1669] Tirmizi 2141, əl-Albani "Həsən".

# QƏZA VƏ QƏDƏRƏ İMANIN FAYDALARI

**1.** ***Razılıq, Yəqinlik Və Əvəz***

***«Allahın izni olmadıqca*** *(heç kəsə)* ***heç bir müsibət üz verməz. Kim Allaha iman gətirsə, Allah onun qəlbini haqqa yönəldər və o, dünyada baş verən hər şeyin Allahın əzəli hökmü və izni ilə olduğunu bilir. Allah hər şeyi*** *(keçmişi, indini və gələcəyi)* **biləndir.** *(ət-Təğabun 11).* Ömər - *radıyallahu anhu* – deyir ki: «Sevmiş olduğum və sevməmiş olduğum şeyə əhəmiyyət vermirəm. Çünki mən xeyrin sevdiyim, yoxsa sevmədiyim şeydəmi olduğunu bilmirəm». Həsənul Bəsri – *rahmətullahi aleyhi* – deyir ki: «Meydana gələn xoşlamadığınız şeyləri və bəlaları pis görməyin. Neçə xoşlamadığınız işlər vardır ki, qurtuluşunuz ondadır və neçə özünüz üçün yaxşı gördüyünüz işlər vardır ki, onda həlakınız vardır». İbn Kəsr – *rahmətullahi aleyhi* – deyir ki: «Müsibətə düçar olan adam bilir ki, bu Allahın qəza və qədəridir. Ona səbr edir, Allahın qəzasına təslim olur və Allah da onun qəlbini hidayətə yönəldir, qəlbinə yəqinlik və dünyada itirdiklərinin daha yaxşısını ona verir». İbn Abbas - *radıyallahu anhu* – deyir ki: «Səbrli adamın qəlbini yəqinliyə yönəldir. O, bilir ki, məruz qaldığı müsibət təsadüfi deyildir. Bu Allahın qəza və qədəridir».

**2.** ***Nəfsin Rahatlığı, Qəlbin Sakitliyi***

Nə vaxt ki, insan bilsə ki, baş verən şeylər Allahın təqdiri ilədir və baş verən şeylər mütləq olmalı idi onda nəfs rahatlanar, qəlb sakitləşər Rəbbin qəzası ilə razılaşar və qədərə iman edəndən daha xoş, sakit və rahat həyatı olan heç kəs olmaz. Əgər sən səbəblərdən[1670] istifadə edərək xoşuna gəlməyən bir şey baş verərsə və əgər Allaha inanırsansa xoşlamadığın bir şeyin baş verməsinə görə Allaha təslim olarsan. Onun təqdir etdiyi ilə razı qalarsan. Allahın təqdir etdiyi elə budur. Əgər Allah belə yazıbsa onun başqa bir hala düşməsi mümkün deyildir. Buna insan iman gətirərsə o, rahatlıq tapar. Əgər bu Allahın mənə yazdığıdırsa və mən də Allahın bəndəsi və mülküyəmsə Allah da öz bəndəsinə və mülkünə istədiyini edə bilər. Bununla o, sakitləşər və rahatlıq tapar. Heç bir kədər hissi də keçirməz. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah kimə xeyir istəyərsə onu imtahanlara məruz qoyar»[1671]. Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mükafatın böyüklüyü bəlanın böyüklüyündən aslıdır. Allah bir qövmü sevərsə onları imtahan edər. Kim (Allahın qədəri) ilə razı qalarsa Allah da onlardan razı qalar, kim də (Allahın qədərinə) razı qalmayıb qəzəb edərsə Allahın da onlara qəzəbi tutar»[1672]. Əgər insan qədərə iman etməzsə onun səbr etməsi də mümkün deyildir. Baxın o, insanlara ki, onlar qədərə inanmırlar. Başlarına bir müsübət gəldikdə səbr etməyib özlərinə intihar edərlər. Məgər bu intihar, özünü öldürmək onları düşdükləri müsibətdən qurtarırmı? Əlbətdə ki, yox! Onlar belə etməklə bundan da şiddətlisinə məruz qalırlar. Əbədi olaraq onlara Cəhənnəmdə özlərinə qəsd etdikləri şeylə cəza veriləcəkdir. Əbu Hureyrə - *radıyallahu*

---

[1670] Səbəblərdən istifadə etdiyin zaman Allaha etimad etməlisən. Çünkü səbəb də, naticə də Allahın təqdiri ilədir. İnsan səbəbdən tutduğu zaman səbəbə deyil Allaha güvənməlidir. Əgər tək səbəbə güvənərsə o, yalnız, tək qalar. Ona heç bir kömək olunmaz. Rəsulullah - *səllallahu aleyhi və səlləm* – duasında buyurur ki: «Ya Həyyu! Ya Qayyumu! Rəhmətinlə yardım diləyirəm. Bütün işlərimi islah et və məni bir göz qırpımı belə öz ixtiyarıma (nəfsimə) buraxma». Həkim 1/545, «Səhihul Tərğib vət Tərhib» 1/273. Səbəbin özündən tutmaq vacibdir. Lakin bununla bərabər Allaha etimad olunmalıdır.

[1671] Buxari 5645

[1672] Tirmizi 2398, əl-Albani zəif.

*anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim özünə intihar edərək dağdan atarsa Cəhənnəmlik olar və orada əbədi olaraq özünü dağdan atar. Kim də zəhər içərək özünə intihar edərsə Cəhənnəm içində əlində zəhər olduğu halda əbədi olaraq ondan içər. Kim də özünə iti bir dəmir soxaraq intihar edərsə Cəhənnəmdə əbədi olaraq o, dəmiri qarnına soxaraq cəzalandırılar»[1673].

O, şey ki, insanın xoşuna gəlmir və onu aradan qaldırmaqda mümkün deyilsə kədərlənmək, peşmançılıq çəkmək və şeytanın ona olan vəsvəsələrinə qulaq asmaq nəyə lazımdır. Allahın qəza və qədərinə inanan insan başına gələn hər bir işdən razı qalar və ondan daha xoş həyatı olan da olmaz.

Görürsən ki, insan müəyyən bir şey üçün səy göstərir, çalışır və dəridən qabıqdan çıxır ki, o iş alınsın. Lakin onunla o, iş arasına qədər girərək işin alınmasına mane olur. Bu şeyə görə kədərlənməməli və peşman olmamalıdır. Əksinə xeyir elə Allahın təqdir etdiyində idi. Məs: Bir tacir böyük ticarət müqaviləsi bağlamaq məqsədilə səfər etmək üçün təyyarə gözləyir. Müəzzin azan verəndə o, girib namazını qılır. Namazı bitirəndən sonra görür ki, təyyarə artıq uçmuşdur. O, olub keçənlərə görə qəm-qüssəyə qərq olub oturur. Bir müddətdən sonra məlum olur ki, təyyarə qəzaya uğramışdır. Səcdə edib sağ qaldığı və namaza görə gecikdiyi üçün Allaha şükr edir. ***«Bəzən xoşlamadığınız bir şey sizin üçün xeyrli, bəzən də xoşladığınız bir şey sizin üçün zərərli ola bilər.*** *(Onu)* ***Allah bilir, siz bilməzsiniz».*** *(əl-Bəqərə 216).*

**3.** ***Sevinməmək Və Kədərlənməmək***

***«Yer üzündə baş verən və sizin öz başınıza gələn elə bir müsibət yoxdur ki, biz onu yaratmamışdan əvvəl o, bir kitabda*** *(Lövhi-Məhfuzda)* ***yazılmış olmasın. Bu Allah üçün çox asandır. Bu sizin əlinizdən çıxana kədərlənməməyiniz və sizə verilənə də sevinib qürrələnməməyiniz üçündür. Allah özünü bəyənən, özü ilə fəxr edən heç bir kəsi sevməz».*** *(əl-Hədid 22-23).* İnsan özü ilə fəxr etməkdən, özü ilə xoşlanmaqdan uzaqlaşmalıdır nə vaxt ki, öz istədiyinə nail olur. Çünkü insanın istədiyinə nail olması Allahın ona verdiyi nemətdir. Özünə arxayın olma ki, mən müəyyən dərəcədə elmliyəm, ibadətim var. Sələflər qorxardılar hidayət olunduqdan sonra da, ibadət, itaət etsələr də belə, Allahın razılığını qazanmağa çalışsalar da belə sonda özlərini heç nə görərdilər. Allahın yanında özlərini ən aşağı insan görərdilər. Fəxr edərək demirdilər ki, biz bunu öz elmimiz, təcrübəmiz, ağlımız və zəhmətimiz sayəsində qazanmışıq. Nəfslərini daima məzzəmmət üzərində qurardılar. Öz nəfslərini qınayaraq deyərdilər ki: «Məgər sən filan günahın sahibi deyilsən». Çünki səni özündən başqa heç kəs yaxşı tanımır. ***«Ürəkləri Rəbbinin hüzuruna qayıdacaqlarından qorxuya düşüb verməli olduqlarını verənlər».*** *(əl-Muminun 60).* Aişə – *radıyallahu anhə* – deyir ki: «Ya Rəsulullah! Bu ayədə söz edilən kimsələr zina edən, içki içən, oğurluq edən və bu işlərdən sonra Allahın əzabından qorxan kimsələrdir?». Peyğəmbər: «Xeyr, ey Sıddıqın qızı! Ayədə qəsd edilən kimsə namaz qılan, oruc tutan, sədəqə verən və bunları etdikdən sonra etdiyi əməllər qəbul olunmaz deyə qorxan

---

[1673] Buxari «Tıbb» 56, Müslim «İman» 109, 175, Tirmizi 2044, 2045, Əbu Davud 3872 Həmçinin başqa rəvayətdə: Sabit b. Dahhaq - *radıyallahu anhu* – (ağac altında Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – beyət edənlərdən biridir) rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər kim İslamdan başqa bir din adına yalandan and içərsə o, kimsə elə dediyi kimidir, kim də özünü bir şeylə öldürüb (intihar edərsə) Qiyamət günü ona o, şeylə də əzab verilər, bir kimsəni yerinə yetirə bilməyəcəyi (gücü çatmadığı) bir şeylə nəzir etməsi mötəbər deyildir, mömini lənətləmək onu öldürmək kimi bir şeydir, kim özünü bir şeylə kəsərsə Qiyamət günü o, şeylə kəsilir, hər kim bir mömini küfürdə ittiham edərsə onu öldürmüş kimidir, hər kim malı çox olsun deyə yalan bir iddia edərsə Allah ona mal azğınlığından başqa bir şey verməz». Buxari 6047, Müslim 110, Tirmizi 2638, Əbu Davud 3257, Nəsai 5-7.

kimsədir» deyə buyurdu[1674]. Həsənul Basri – *rahmətullahi aleyhi* – deyir ki: «Mömin iki şeyi özündə birləşdirir. Yaxşı əməl ilə qorxunu (Başqa rəvayətdə: Qorxu və ümüd möminin iki miniyidir). Münafiq isə iki şeyi cəm edər. Pis əməl ilə arxayınçılığı». Əksinə bu nemətə görə Allaha şükr edər və nəfsi ilə xoşlanmağı, fəxr etməyi də tərk edərdilər. ***«Onlar İslamı qəbul etdiklərinə görə sənə minnət qoyurlar. De ki: Müsəlman olduğunuzla mənə minnət qoymayın! Xeyr, əgər*** *(iman gətirdiyinizi)* ***doğru deyirsinizsə,*** *(bilin ki)* ***sizi imana müvəffəq etməklə əslində Allah sizin boynunuza minnət qoymuş olar»*** *(əl-Hucurat 17).* ***«Başına gələn müsibətdən sonra dərgahımızdan ona bir mərhəmət əta etsək mütləq: Bu elə mənim haqqımdır. Qiyamətin qopacağını güman etmirəm. Doğurdan da əgər Rəbbimin hüzuruna qaytarılıb gətrilsəm Onun dərgahında məni ən gözəl nemət*** *(Cənnət)* ***gözləyir deyər. Biz kafir olanlara nə etdiklərini mütləq*** *(bir-bir)* ***xəbər verəcək və sözsüz ki, onlara şiddətli bir əzab daddıracağıq.*** *(Kafir, naşükür)* ***insana nemət bəxş etdiyimiz zaman*** *(imandan)* ***üz döndərər, haqdan uzaqlaşıb yan gəzər. Ona bir pislik üz verdikdə*** *(Rəbbinə)* ***uzun-uzadı dua edər*** *(yaxşı gündə Allahı unudar, dar gündə dərhal Ona yalvarar)»* *(Fussilət 50-51).* ***«Bu mənə yalnız məndə olan elm sayəsində verilmişdir. Məgər Qarun Allahın ondan əvvəl özündən daha qüvvətli və daha varlı olan neçə-neçə kəsləri məhv etdiyini bilmirdimi? Günahkarlar öz günahları barəsində sorğu-sual olunmazlar».*** *(əl-Qəsəs 78).* ***«Bu mənə yalnız biliyimə görə verilmişdir! Deyər. Xeyr, bu bir imtahandır».*** *(əz-Zumər 49).* ***«İnsana gəldikdə isə Rəbbin onu imtahana çəkib ehtiram etsə, ona bir nemət versə o: «Rəbbim mənə ehtiram göstərdi!» deyər. Amma nə zaman rəbbin onu imtahana çəkib ruzisini əskiltsə: «Rəbbim məni alçaltdı, mənə xor baxdı!» deyər».*** *(əl-Fəcr 15,16).* Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah İsrail oğullarından cüzəm xəstəliyinə tutulanı, keçəli və koru imtahan etmək üçün yanlarına bir mələk göndərir. Mələk cüzəm xəstəliyinə tutulanınn yanına gələrək: «Ən çox nəyi arzu edirsən?» deyə soruşur. Cüzəm: «Gözəl rəng, gözəl dəri və insanları məndən iyrəndirərək uzaqlaşdıran bu xəstəliyin getməsini arzu edirəm!» dedi. Mələk cüzəmin vücuduna əl sürtdü. Dərhal ondan bu xəstəlik getdi və ona gözəl rənglə, gözəl dəri verildi. Mələk: «Ən çox sevdiyin mal hansıdır?» dedi. Cüzəm: «Dəvə və ya inək!» deyə cavab verdi. Ona on aylıq bir dəvə verildi. Mələk: «Allah bunu sənin üçün bərəkətli etsin!» deyə dua etdi. Sonra mələk keçəlin yanına gələrək: «Ən çox nəyi arzu edirsən?» deyə soruşur. Keçəl: «Gözəl saç və insanları diksindirərək məndən uzaqlaşdıran bu keçəlliyin getməsini arzu edirəm!» deyə cavab verdi. Mələk onun da vücuduna əl sürtdü. Dərhal keçəllik ondan gedərək yerinə gözəl saç verildi. Mələk: «Ən çox sevdiyin mal hansıdır?» dedi. Keçəl: «İnək!» deyə cavab verdi. Ona da balalı bir inək verildi. Mələk: «Allah bunu sənin üçün bərəkətli etsin!» deyə dua etdi. Sonra mələk korun yanına gələrək: «Sən ən çox nəyi arzulayırsan?» deyə soruşur. Kor: «Allahdan gözlərimi geri qaytarmasını və insanları görməyimi arzu edirəm!» deyə cavab verdi. Mələk ona da əl sürtdü və Allah ona görmə qabiliyyətini verdi. Mələk: «Ən çox sevdiyin mal hansıdır?» dedi. Kor: «Qoyun!» deyə cavab verdi. Ona da balalı qoyun verildi.

Bir müddətdən sonra dəvə və mal-qara sahiblərinin heyvanları bala verdilər. Qoyun sahibinin də qoyunu quzuladı. O, qədər ki, dəvə sahiblərinin bir vadi dəvəsi, mal-qara sahibinin bir vadi mal-qarası, qoyun sahibinin də bir vadi dolusu qoyunları oldu.

---

[1674] Buxari, Müslim.

Günlərin birində mələk bu üç kimsə ilə görüşmək üçün ilk görüşdüyü surətdə cüzəmin yanına gəldi və ona: «Mən kasıb birisiyəm. Səfər zamanı bütün azuqəmdən məhrum olmuşam. Bu günki gündə Allahdan, sonra da səndən başqa müraciət edəcəyim yer yoxdur. Sənə gözəl rəng, gözəl dəri və gözəl mal verən Allah xatirinə səndən bu səfərimi bitirib (yurduma) çatmaq üçün dəvə istəyirəm. Cüzəm: «Borcum çoxdur və (sənə verəcəyim malım da yoxdur)» dedi. Mələk: «Mən səni tanıyıram. Sən insanların iyrənərək çəkindiyi və Allahın var-dövlət verdiyi kasıb deyilsən?» dedi. Cüzəm: «Xeyr, mənə bu mal-qara ata babamdan mülk qalıb!» deyə cavab verdi. Mələk: «Əgər sən yalan deyirsənsə qoy Allah səni əvvəlki vəziyyətinə qaytarsın!» dedi. Sonra mələk keçəlin yanına gəldiyi ilk görkəmdə gələrək ona da cüzəmə dediyi sözlərin eynisini dedi. Keçəl də cüzəmin verdiyi cavabın eynisini vedi. Mələk ona da bəd dua edərək: «Qoy Allah səni də əvvəlki vəziyyətinə qaytarsın?» dedi. Mələk bundan əvvəlki surətdə gəldiyi kimi korun da yanına gələrək ona da: «Mən kasıb birisiyəm. Səfər zamanı bütün azuqəmdən məhrum olmuşam. Bu günki gündə Allahdan, sonra səndən başqa müraciət edəcəyim yer yoxdur. Sənə gözünü qaytaran Allah and verirəm səndən bu səfərimi bitirib (yurduma) çatmaq üçün qoyun istəyirəm». Kor: «İstədiyin qədər götür və istədiyin qədər də saxla. Həqiqətən mən kor bir kimsə idim. Allah mənə gözlərimin nurunu verdi. Vallahi bu gün Allah üçün alacağın (götürəcəyin) heç bir şeydə sənə əngəl olmayacağam və götürdüklərini geri qaytarılmasını da istəmirəm!» deyə cavab verdi. Mələk: «Malını saxla özünə. Allah sizləri imtahan etdi və səndən də razı qaldı. O, iki yoldaşına isə qəzəb etdi» deyə cavab verdi. Bəğavi – *rahmətullahi aleyhi* – deyir ki: «(Bu nemət mənə) Allahdan mənə gəlmiş bir elm üzərə verilmişdir. Doğrusu bu mənim haqqımdır». Bilirəm ki, dünya həyatında bu mənə verildiyinə görə Allah qatında mənim yerim, şərəfim vardır. Mücahid – *rahmətullahi aleyhi* – deyir ki: «Bu yaxşılığı əməlim sayəsində qazandım. Mən bu yaxşılığı haqq etdim». İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: «Allahın sizə bəxş etdiyi nemətlərlə qürrələnib insanlar arasında fəxr etməyin. Bu sizin əməyinizin nəticəsi olmayıb, Allahın qəza və qədəri ilə sizə bəxş edilən ruzisidir. Allahın nemətləri ilə təkəbbür və lovğalığ etməyin. Sevincinizi şükrə, kədərinizi isə səbrə çevirin».

**4. *İnsanlardan Qorxmamaq***

***De ki: «Elə isə bir söyləyin görək, əgər Allah mənə bir zərər toxundurmaq istəsə, sizin Allahdan qeyri ibadət etdikləriniz onun zərərini aradan qaldıra bilərlərmi?» Yaxud: «Əgər Allah mənə bir mərhəmət əta etmək istəsə, onlar onun mərhəmətinə mane ola bilərlərmi?» De ki: «Mənə təkcə Allah kifayət edər».*** *(əz-Zumər 38).* ***«Əgər Allah sənə bir zərər yetirsə, səni ondan Allahdan başqa heç kəs qurtara bilməz. Əgər Allah sənə bir xeyir diləsə, heç kəs onun nemətinə maneçilik edə bilməz».*** *(Yunus 107).* Qul hər şeyin Allahdan gəldiyini bildiyinə görə yalnız Allah hüzurunda qorxu və sayğı duymalı və yalnız Ona qarşı təqvalı davranmalıdır. ***«O, halda insanlardan qorxmayın Məndən qorxun».*** *(əl-Maidə 44).* ***«…Və yalnız Məndən qorxun».*** *(əl-Bəqərə 40).* ***«Allaha və onun Peyğəmbərinə itaət edənlər, Allahdan qorxub çəkinənlər məhz beləlləri uğura çatanlardır».*** *(ən-Nur 52).* ***«…Qorxub çəkinməyə də,*** *(günahları)* ***bağışlamağa da layiq olan ancaq Odur».*** *(əl-Muddəssir 56).* Hər bir məxluqun bir yaradılmışdan ya da yaradıcıdan qoxmasının qaçınılmaz olduğu məlumdur. Yaradılmışdan qorxmanın zərəri bir çox baxımdan faydalarından daha

[1675] Buxari 3464, Müslim 2964.
[1676] İbn Kəsir «Təfsir» 4/314.

ağırdır. Allahdan qorxmaq isə dünya və axirət səadətinin səbəbidir. Həqiqətən Allah ondan qorxulmaya layiqdir. Günahları bağışlayan da Odur, heç bir yaradılmış günahları bağışlamaya qadir deyildir. Əbul-Abbas Abdullah b. Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, bir gün (minikdə) Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in arxasında idim. O, buyurdu: «Ey oğul! Mən sənə bir neçə kəlimə öyrədəcəm... Bunu da bil ki, əğər bütün insanlar sənə xeyir vermək üçün bir yerə yığışsalar Allahın yazdığından artıq sənə heç bir xeyir verə bilməzlər. Bunu da bil ki, əğər sənə zərər vermək üçün bir yerə yığışsalar yenə də Allahın yazdığından artıq sənə zərər verə bilməzlər. (Çünkü) qələmlər qaldırılmış, səhifələrin (mürəkkəbi) qurumuşdur» . İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Həqiqətən də dünyada bir Cənnət vardır ki, kim o Cənnətə girməzsə axirətin Cənnətinə daxil olmaz. Düşmənlərim mənimlə nə edə bilər. Mənim Cənnətim, bağım qəlbimdədir. Hara getsəm o, da mənimlədir. Məndən ayrılmazdır. Həbs olunmağım Allah ilə tək qalmağımdır, öldürülməyim şəhidlikdir, sürgün olunmağım isə mənim üçün səfərdir».

**5. *Olub Keçənlərə Peşman Olmamaq***

İnsan istədiyi şey alınmadıqda, xoşlamadığı bir şey baş verdikdə narahatçılığı, peşmançılığı, qəzəblənməyi, özündən tez çıxmağı dəf edə bilməlidir. O, bilməlidir ki, bunların hamısı Allahın təqdiri ilədir. O, Allah ki, göylərin və yerlərin mülkü onun əlindədir. Bu kimi şeylərə görə səbr edər və əcrini də Allahdan gözləyər. Bu da insanın qədərə inanmasının böyük səmərlərindən biridir. İnsanın özündən narahatçılığını, peşmançılığını qovur. İnsan bilməlidir ki, bu belə də olmalı idi. Başqa çür olması mümkün də deyildir. Bəzən görürsən ki, insan hansısa işi düzəltmək, islah etmək istəyir. Lakin iş istədiyinin əksi olaraq alınır. Məs: Görürsən ki, insan qələmini düzəltmək istədiyi halda onu vurub sındırır. Qədər onun əksinə olur və o, bilməlidir ki, bu belə də olmalı idi. Başqa cür olması da mümkün deyildir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – duasında buyurardı: «Allahım! Verdiyinə mane ola biləcək, vermədiyini də verə biləcək yoxdur» . ***«****(Müharibəyə getməyib Mədinədə evlərində)* ***oturan və*** *(müharibəyə getmiş)* ***qardaşları haqqında: «Əgər onlar sözümüzə qulaq assaydılar, öldürülməzdilər» deyənlərə*** *(Ya Muhəmməd!)* ***söylə ki: «Əgər doğru deyirsinizsə, onda*** *(bacarıb)* ***ölmü özünüzdən uzaqlaşdırın».*** *(Ali-İmran 168).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah güclü mömini zəif mömindən daha çox sevir. Hər bir işdə özünə faydalı olanı götürməyə səy göstər. Allahdan kömək dilə aciz olma. Başına bir müsibət gələrsə demə: «Əgər belə etsəydim belə olmazdı» De ki: «Allahın qəza və qədəri bu imiş. Əgər sözü şeytana yol açır» .

**6. *Günahların Təmizlənməsi***

Əbu Səid əl-Xudri və Əbu Hureyrə - *radıyallahu anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mömini nə yorğunluq, nə xəstəlik, nə əzab-əziyyət, nə rahatsızlıq, nə kədər, nə də bədəninə batan tikan maraqlandırır. Onu maraqlandıran Allahın bunlara səbr etdiyinə görə günahlarını təmizləməlidir» . İbn Məsud - *radıyallahu anhum* – rəvayət edir ki, qızdırmadan əziyyət çəkən Peyğəmbər –*sallallahu aleyhi və səlləm* – in yanına daxil oldum: «Ya Rəsulallah! Bu xəstəlikdən nə çox izdirab çəkirsən». Peyğəmbər: «Bəli, mənim xəstəli-

---

[1677] Tirmizi 2516, əl-Albani «Səhih əl-Cəmi» 7834-cü hədis.
[1678] Buxari 1/255, Müslim 1/414.
[1679] Buxari, Müslim.
[1680] Buxari, Müslim.

yim sizdən iki nəfərin (bu xəstəlikdən) çəkdiyi izdirab kimidir». Mən: «Bu ona görədir ki, sən bu xəstəlikdən iki qat əcr qazanırsan?» deyə soruşdum. Peyğəmbər: «Bəli, bu belədir deyərək istənilən müsəlmanın başına gələn xəstəlik, bədəninə batan tikan və bundan daha böyük hər hansı qəza başına gələrsə Allah bu səbəblə onun pisliklərini örtər və o, kimsə günahlarını ağac yarpaqlarını tökdüyü kimi tökər» . Əbu Hureyrə - *radıyallahu anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mömin və möminə xanım daima Allahın imtahanlarına məruz qalacaqlar. O, imtahanlar ki, onların özlərinə, uşaqlarına və mallarına toxunacaqdır o, vaxta qədər ki, onlar öz Rəbblərini günahsız qarşılayana qədər» . ***«Sizə üz verən hər bir müsibət öz əllərinizlə qazandığınız günahların*** *(etdiyiniz əməllərin)* ***ucbatındandır».*** *(əş-Şura 30).*

**7.** ***Böyük Əcr (Mükafatın) Verilməsi***

***«Əlbəttə, biz sizi bir az qorxu, bir az aclıq, bir az da mal, can*** *(övlad)* ***və məhsul qıtlığı ilə imtahan edərik.*** *(Ya Muhəmməd! Belə imtahanlara)* ***səbr edən şəxslərə müjdə ver. O, kəslər ki, başlarına bir müsibət gəldiyi zaman: «Biz Allahın bəndələriyik və*** *(öləndən sonra)* ***ona tərəf*** *(onun dərgahına)* ***qayıdacağıq» deyirlər.*** *(əl-Bəqərə 155-156).* Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah buyurdu – mömin qulumun ən çox sevdiyi insanları əlindən alsam və o da buna səbr edərək əcrini Məndən gözləyərsə, Məndə ona Cənnətdən başqa bir mükafat olmaz» . Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah buyurdu – İki gözünü alaraq qulumu imtahan etdiyim zaman səbr edərsə, onların yerinə ona Cənnəti verərəm» . Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah kimə xeyir diləyərsə onu imtahanlara məruz qoyar» .

**8.** ***Ölümdən Qorxmamaq***

***«Allahın izni olmayınca heç kəsə ölüm yoxdur. O,*** *(lövhi-məhfuzda)* ***vaxtı müəyyən edilmiş bir yazıdır».*** *(Ali-İmran 145).* İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Hər bir şey səbədləri ilə bərabər təqdir edilmişdir. Bunlardan biri də duadır[1686]. Səbəbsiz olaraq heç bir şey təqdir edilməmişdir. Hər bir şeyin təqdir edilmiş bir səbəbi vardır. Qul səbəbi etdiyi zaman təqdir edilmiş hadisə baş verir, əksi təqdirdə baş vermir. Həqiqətən aclığı dəf etmək və susuzluğu götürmək - yemək və içməklə bağlıdır, uşağın olması isə - yaxınlıqla, məhsul yığımı - əkinçiliklə, (qurbanlıq) heyvanın ölümü - onun kəsilməsiylə, həmçinin Cənnətə düşməkdə əməllər (səbəbilədir), Cəhənnəmə düşmək – *Allah Qorusun* – digər (əmmələrlə) bağlıdır"[1687]. Rəvayət edilir ki, Əbu Ubeydə Ami b. əl-Cərrah - *radıyallahu anhu* –, Ömər - *radıyallahu anhu* – nun Şamda Taun xəstəliyinin yayılmasına görə şəhərə girməmək qərarına qarşı etiraz edərək dedi: "Ey möminləri əmiri! Allahın bizim üçün təqdir

---

[1681] Buxari 5647, Müslim 2571.
[1682] Tirmizi 2401.
[1683] Buxari 6424.
[1684] Buxari 5653.
[1685] Buxari 5645.
[1686] İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Dua baş verən və baş verməyən (hadisələrdən) kömək edir. Ey Allahın qulları! Allaha dua edin". Həkim, əl-Albani "Səhih Cəmius Sağir" 1/641.
[1687] Cavabul Kəfi s. 24.

etdiyi qədərdən qaçırıq?". Ömər: "Ey Əbu Ubydə! Bu sözləri başqası desəydi? Bəli, biz Allahın qədərindən digər qədərinə qaçırıq" dedi[1688].

**9.** ***Hər Çətinlikdən Sonra Asantlıqlar Vardır***

Əbul-Abbas Abdullah b. Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, bir gün (minikdə) Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in arxasında idim. O, buyurdu: «Ey oğul! Mən sənə bir neçə kəlimə öyrədəcəm... ***Bunu da bil ki, (Allahın) yardımı, zəfəri - səbrlə birlikdədir. Qurtuluş – kədər və sıxıntı ilə bərabərdir və şübhəsiz ki, hər bir çətinlikdən sonra - asanlıq va***rdır» .

İnsanlar içəisində ən çox rahatlıq içində olanı ən çox yorulanıdır. Yorğunçuluqdan sonra rahatlıq gəlir. Deyirlər ki: «Dünyada ağalığa çatmaq və axirətdə də səadətə çatmaq üçün yorğunluq körpüsünün üstündən keçmək lazımdır». Rahatçılığın arxasından həsrət gəlir. Peyğəmbər –*sallallahu aleyhi və səlləm* – buyurdu: «Dünya möminin zindanı, kafirin isə Cənnətidir» . Şair deyir ki: «Mən böyük bir rahatçılıq gördüm. Lakin ardından yorğunçuluq vardır. Əgər məşəqqət olmasaydı hamı ağa olardı». Əbu Musa əl-Əşari - *radıyallahu anhu* – gecə və gündüz oruc tutur və ona deyirlər ki: «Nəfsinə istirahət ver!». O: «Kim rahatlığı tələb edirsə rahatlığı tərk edər». İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Kim rahatlığı üstün tutarsa o, rahatlığı ötürər. İnsan nə qədər bu məşəqqətlərə və çətinliklərə dözərsə bir o qədər də sevinər, ləzzət alar. Himməsi olmayanın sevinci də olmaz, səbri olmayanın ləzzəti də olmaz, bədbəxçiliyi (çətinliyi) olmayanın da neməti olmaz, yorğunçuluğu olmayanın da rahatçılığı olmaz». Sələflər deyirlər ki: «Elm rahat bədənlə alınmaz. Rahatlıq yalnız yorğunluqla əldə edilir. Nemətlərə çatmaq yalnız o, yolda olan çətinliklərə dözməklə olur. Bu rahatlığa yalnız Cənnətdə çatılır». Rabi b. Xuseymə – *rahmətullahi aleyhi* – yə dedilər ki, nəfsinə bir az rahatlıq ver! O: «Mən onun rahatlığını istəyirəm». İmam Əhməd – *rahmətullahi aleyhi* – dən soruşdular ki: «İnsan nə zaman rahatlıq tapar?». O: «Birinci ayağını Cənnətə qoyduğu zaman».

**10.** ***Bil Ki, Səndən Yan Keçən Bəla Sənə Toxunmamalı İd, Başına Gələn Bəla İsə Səndən Yan Keçməməli İdi***

Əbul-Abbas Abdullah b. Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, bir gün (minikdə) Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in arxasında idim. O, buyurdu: «Ey oğul! Mən sənə bir neçə kəlimə öyrədəcəm... ***Bil ki, səndən yan keçən bəla sənə toxunmamalı idi. Başına gələn bəla isə səndən yan keçməməli idi***»[1692]. İbn Deyləmi deyir ki, Ubey b. Kəb - *radıyallahu anhu* – nun yanına gələrək dedim: "Qəlbimdə Qədərə qarşı bəzi şübhələr yer almışdır. Mənə elə bir şeylər danış ki, Allah onları qəlbimdən dəf etsin". O: "Əgər Allah yer və göy əhlini cəzalandırsaydı bu iş ədalətli olardı, əgər O hamısını əff etsəydi Onun mərhəməti onların əməllərinin qazandığı həsənətdən çox olardı. Əgər sən Uhud dağı boyda qızıl xərcləsən, lakin Qədərə iman etmədikcə, sənin başına gələn hər bir şeyin səndən yan keçmədiyinə, səndən ötüb keçənin isə sənin başına gəlmədiyinə iman etmədikcə Allah bunu səndən qəbul etməz. Əgər bunlara iman etmədən ölsən Cəhənnəmə düşərsən". Bundan sonra mən İbn

---

[1688] İbn Həcər "Fəthul Bəri" 10/179.
[1689] Tirmizi 2516, əl-Albani «Səhih əl-Cəmi» 7834.
[1690] Müslim 2956.
[1691] ***Himmə*** **–** Qarşındakı çətinlikləri asant görmək, iradə sahibi.
[1692] Tirmizi 2516, əl-Albani «Səhih əl-Cəmi» 7834, əl-Albaninin təhqiqi ilə «Riyadus-Salihin» 63.

Məsud, Huzeyfə b. Yəmən və Zeyd b. Sabit - *radıyallahu anhum* – un yanına da getdim. Onlar da eyni şeyi söylədilər"[1693].

Əgər sən bu bölümü düzgün şəkildə yerinə yetirə bilsən qəlbin Allahın təqdir etdiyi Qədər ilə razılaşmasını və bununla təskinlik tapmasını vacib edər. ***«Bu sizin əlinizdən çıxana gədərlənməməyiniz və və sizə veriləna də sevinib qürrələnməməyiniz üçündür. Allah özünü bəyənən, özü ilə fəxr edən heç bir kəsi sevməz».*** *(əl-Hədid 23).* əd-Dəhhaq – *rahmətullahi aleyhi* – deyir ki: «Sizə təqdir etmədiyimiz dünyəvi şeylərə görə kədərlənməyin, sizə verdiyimiz dünyəvi şeylər barəsində sevinməyin. Əgər o, yazılıbsa sizdən yan keçən deyildir. Sizə verilməlidir». Sələflərdən biri deyir ki: «Qədərə iman gətirmək insanın kədərini, qəmini, hüznünü aradan qaldırır». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – də buna işarə edərək buyurur: «Allah güclü mömini zəif möminden daha çox sevir. Hər bir işdə özünə faydalı olanı götürməyə səy göstər. Allahdan kömək dilə aciz olma. Başına bir müsibət gələrsə demə: «Əgər belə etsəydim belə olmazdı» De ki: «Allahın qəza və qədəri bu imiş. Əgər sözü şeytana yol açır» . Bu hədis onu bildirir ki, insanın öz nəfsinə xatırlatması keçmişi (yazılmış Qədəri) müsibət zamanı artıq o, şeytanın vəsvəsələrini ondan uzaqlaşdırır. O, vəsvəsələr ki, insana dərdi, qəmi, kədəri, peşmançılığı gətirir. İnsan bilsə ki, bu yazılan olmalı baş verməli idi. Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – ə on il xidmət etdim. Bir dəfə də olsun mənə uf demədi, üstümə qışqırmadı. Etdiyim bir işdən ötrü nə üçün onu etdin, etmədiyim bir işdən ötrü də nə üçün bu işi etmədin deyə demədi (Bağqa rəvayətdə: Əgər xanımlarından biri məni qınamış olsaydı ona: Onu buraxın. Çünkü nə təqdir edilmişsə o, da olur )» .

Yalnız Onun istədiyi olur. İnsanın da buna iman gətirməsi ondan dərdi, qəmi, kədəri qaldırır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bir kişiyə tövsiyə edərkən buyurdu: «Allahın sənə təqdir etdiyi bir şeydə Allahı imtahan etməyin». Əgər mömin insan Allahın təqdir etdiyində olan hikmətə, rəhmətə baxarsa bu onu Allahın təqdir etdiyi ilə razı qalmasına yönəldər. ***«Allahın izni olmadıqca*** *(heç kəsə)* ***heç bir müsibət üz verməz. Kim Allaha iman gətirsə Allah onun qəlbini haqqa doğru yönəldər və o, dünyada baş verən hər şeyin Allahın əzəli hökmü və izni ilə olduğunu bilər. Allah hər şeyi biləndir».*** *(ət-Təğabun 11).* Əlqamə – *rahmətullahi aleyhi* – deyir ki: ***«Kim Allaha iman gətirsə Allah onun qəlbini haqqa doğru yönəldər...»*** Bu o, kimsədir ki, başına bir müsibət gəlir və bilir ki, bu Allah tərəfindəndir və müsibətə təslim olur və onunla razı qalır. Suheyb - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Möminin işinə heyrat edirəm. Çünki onun hər bir işi xeyirdir. Bu hal mömindən başqa heç bir kimsə üçün deyildir. Onun başına bir sevinc verici bir şey icabət edərsə şükr edər. Bu da onun üçün bir xeyir olar. Əgər onun başına zərər və ziyan verici bir hal icabət edərsə səbr edər və bu hal da onun üçün xeyirli olar» . Hər iki halda da xeyiri qazanması mömindən başqasında ola bilməz. Müsibət və xeyiri də qarşılamaq üçün mömində əsaslar vardır və o, bilir bunları necə qarşılasın. ***«De ki: Allahın bizim üçün yazdığından başqa bizə heç bir şey üz verməz».*** *(ət-Tövbə 51).* Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mükafatın böyüklüyü bəlanın böyüklüyündən aslıdır. Allah bir

---

[1693] Əbu Davud 3699.
[1694] Buxari, Müslim.
[1695] Beyhəqi.
[1696] Müslim.
[1697] Müslim 2999.

qövmü sevərsə onları imtahan edər. Kim (Allahın qədəri) ilə razı qalarsa Allah da onlardan razı qalar, kim də (Allahın qədərinə) razı qalmayıb qəzəb edərsə Allahın da onlara qəzəbi tutar»[1698]. Əbu Dərda - *radıyallahu anhu* – deyir ki: «Allah bir şeyi təqdir etdiyi zaman ondan razı qalmasını istəyər». Ummu Dərda - *radıyallahu anhə* – deyir ki: «Allahın təqdir etdiyi ilə razı qalanlar o, kəslərdir ki, Allah nəyi təqdir etdisə onunla razı qaldılar. Onlar üçün Cənnətdə dərəcələr vardır. Elə bir dərəcələr ki, hətta şəhidlər Qiyamət günü o, dərəcələrə qiptə edərlər». İbn Məsud - *radıyallahu anhu* – deyir ki: «Allah sevinci, fərəhi yəqində və razılıqda qoymuşdur. Dərdi və kədəri şəkdə və qəzəbdə qoymuşdur». Ömər b. AbdulAziz – *rahmətullahi aleyhi* – dualarında deyərdi: «Allahumə! Qəza və qədərində məni razı sal və o təqdir etdiyinə bərəkət qoy.Hətta mən bununla razı qalım və Sənin gecikdirdiyin şeyi tez istəməyim və ya tezləşdirdiyin bir şeyin gecikməsini istəməyim». Bil ki, bəndə razılığın dərəcəsinə çatmaz hətta o, kimsə kasıblıq və müsibət zamanı razı qalmasa necə ki, varlılıqda və əmin-amanlıqda razı qaldığı kimi. Sən Allahdan öz işin barəsində xeyirli olanı istəyirsən və nəfsinə uyğun olmayan bir iş baş verdikdə və ya təqdir olduqda qəzəblənirsən. Bəlkə də sənin xeyirin nəfsinə uyğun (xoş gəlməyən) bir şeydədir. Əgər sənə istədiyin o, şey təqdir olsaydı bəlkə də sənin həlakın orada olardı. Lakin təqdir olunan şey sənin nəfsinə uyğun gəldikdə isə sən razı qalırsan. Bu da sənin qədər barəsində elminin azlığındandır. İbn Aun – *rahmətullahi aleyhi* – deyir ki: «Allahın Qəza və qədəri ilə razı qal. Sən belə etsən dərdin az olar və axirət işlərin üçün bu daha xeyirli olar».

Əgər bəndə Allahdan xeyir-bərəkət diləyərək İstixarə edirsə o, zaman ona lazımdır ki, Allahın onun üçün seçdiyi ilə razı qalsın. Seçilən əməl onun nəfsinə müvafiq olsada, olmasa da belə. Çünki insan bilmir xeyir nəfsinə müvafiq olandadır, yoxsa olmayanda. Ona görə də Sələflərdən bir dəstəsi İbn Məsud və s. əmr etmişlər ki, əgər bir insan təqdir edilmiş şeyin nəfsi istəyinə müxalif olduğu zaman səbr edə bilməyəcəksə o, kimsə İstixarə etdiyi zaman rahatlıqda sözünü işlətsin. Məs: Allahım! Səndən filan şeyi istəyirəm rahatlıqda.

***İnsanın Təqdir Olunanla Razı Qalması Üçün Bəzi Səbəblər Vardır:*** **1)** İnsan yəqin bilməlidir ki, Allah mömin üçün nəyi təqdir edibsə onda xeyir vardır. Bununla o, kimsə xəstə misalında olur hansı ki, özünü mahir, nəsihət edən bir həkimə təslim etmişdir. Həkim o, xəstəni incitsə də belə ondan razı qalır ona olan inancına görə. İnsan bilir ki, həkim onun xeyrini istəyir. İnsan bunu dərk etsə başına gələn bütün müsibətlərlə razı qalar. **2)** İnsan bu razılığın qarşılığında Allahın ona nə qədər savab vəd etdiyinə baxsın. Əgər insan müsibət zamanı razılığın qarşılığını bilərsə razı qalar. Onun razılığı o, qədər güclənər ki, təqdir olunan müsibətin ağrısıbını unutdurar. Saleh qadınlardan birinin dırnağı qırılır və o, gülərək deyir: «Bunun savabının ləzzəti mənə onun ağrısının acılığını unutdurdu». **3)** O, bəla verənin sevgisində dərinliyə getmək. Bəla verənin əzəmətini, kamilliyini bilmək. İnsan bu dərəcəyə çatarsa o, ağrını heç hiss etməz Ona olan sevgiyə görə. Necə ki, Yusuf – *əleyhissəlam* - görən qadınlar onu gördükləri zaman unudaraq əllərini kəsdilər və o ağrını da hiss etmədilər. İnsan Allahı, o bəla verəni sevərsə ağrıları hiss etməz. Heç sevən insan da bəlanı, müsibəti hiss edərmi? Bəzi müsibət əhli demişlər ki: «Qoy Allah istədiyini etsin. Hətta bizi tikə-tikə doğrasalarda biz yalnız Ona qarşı sevgidə artacağıq». Sələflərdən birinin yanına xəstə ikən (ziyarət məqsədilə) daxil olurlar və ondan: «Sənə seimli olan nədir?» deyə soruşurlar. O: «Mənə sevimli olan Allaha ən sevimli olanıdır». Sələflərdən bir kişinin

---

[1698] Tirmizi 2398, əl-Albani zəif.

oğlu cihadda dünyasını dəyişmişdr. Onun yanına başsağlığı vermək üçün gələnlər onun ağladığını görüb soruşdular: «Səni ağladan nədir?». O: «Mən onun öldürülməsinə görə ağlamıram, mən ağlayıram ona görə ki, öldüyü zaman onun Allahdan razılığı necə idi». Bütün bunlar onu göstərir ki, müsibətlərə, bəlalara razı qalması vacib deyildir. Bu bəyənilən, müstəhəb bir əməldir. Lakin kim razılığı bacarmasa qoy səbrə yönəlsin. Çünkü səbr etmək vacibdir. ***«Yalnız** (dünyada Allah yolunda çətinliklərə)* ***səbr edənlərə** (axirətdə)* ***saysız-hesabsız mükafat veriləcəkdir!».*** *(əz-Zumər 10).* İnsan bacardığı qədər razılıq dərəcəsini qazanmağa çalışmalıdır. Həsənul Bəsri – *rahmətullahi aleyhi* – deyir ki: «Razılıq məqamı ağırdır. Lakin mömininin sığınacaq yeri səbrdir». Səbrin mahiyyəti odur ki, insanın nəfsini saxlaması, qəzəblənməkdən həps etməsi. Lakin bununla yanaşı qəlbində ağrı vrdır. Razılıq isə müsibətlə yanaşı köksünün genişliyini vacib edir. Hətta qəlbdə o, ağrı olsa da belə razılıq o, ağrının hissiyatını yüngülləşdirir. Bəzəndə o, hissiyatı razılıq bütünlüklə aradan qaldırır.

Ömər b. AbdulAziz, Fudeyl b. İyad – *Allah Onlardan Razı Olsun* – deyirlər ki: «Razı insan o kəsdir ki, olduğu haldan (başına gələn müsibətdən) başqasını arzulamır. Səbr edən kimsə isə səbr edir, lakin başqa halı arzulayır». Səbr müsibətin ilk anında olduğu kimi, razılıq isə müsibət baş verdikdən sonra olur. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dualarında buyurardı: «Allahım! Mən səndən Qəza və qədərindən sonra razı qalmağı diləyirəm». Kim bəla baş verəndən sonra razı qalarsa həqiqi razılıq da elə budur. Kim müsibət zamanı Allahın təqdir etdiyinə qəzəblənərsə onun ağrı çəkməsi ilə yanaşı Allahın qəzəbi də vardır.

***Səbr*** – həps etmək deməkdir. Üç növdür. **1.** Qəza və Qədər ilə təqdir edilənlərə səbr (bəla, müsibətlər və s). **2.** Əmr edilənlərə səbr etmək (namaz, oruc və s). **3.** Qadağan edilənlərə səbr (haramlara qarşı səbrli olmaq). ***«Ey iman gətirənlər! Səbr və dua ilə Allahdan kömək diləyin. Allah səbr edənlərlədir».*** *(əl-Bəqərə 153).* ***«Ey iman gətirənlər! Səbr edin, dözün, hazır olun və Allahdan qorxun ki, bəlkə nicat tapasınız».*** *(Ali İmran 200).* ***«And olsun ki, biz içərinizdəki mücahidləri və səbr edənləri ayırd edib bilmək üçün sizi imtahana çəkəcək və əməllərinizi də yoxlayacağıq».*** *(Məhəmməd 31).* ***«Əlbəttə biz sizi bir az qorxu, aclıq, bir az malnan və məhsul qıtlığı ilə imtahan edərik. Səbr edən şəxslərə müjdə ver».*** *(əl-Bəqərə 155).* Ömər – *radıyallahu anhu* – deyir ki: «Biz gözəl həyatı səbrlə hiss etdik» Buxari, Əhməd. Əli – *radıyallahu anhu* – deyir ki: «İmansız səbr başsız adam kimidir. Səbri olmayanın imanı da olmaz». İbn Məsud – *radıyallahu anhu* – deyir ki: «İnam imanın hamısıdır. Səbr isə imanın yarısıdır».

Səbr Cənnətin xəzinələrindən bir xəzinədir. Allahda bunu yalnız istədiyi quluna, hörmətli kimsəyə nəsib edir. Meymun b. Məhrəm – *rahmətullahi aleyhi* – deyir ki: «Heç kəs hətta Peyğəmbər də, ondan aşağı olan kimsələrdə böyük bir xeyiri sbrdən başqası ilə almamışlar». İbrahim ət-Teymi – *rahmətullahi aleyhi* – deyir ki: «ƏgərAllah insana əziyyətə qarşı səbr veribsə o kimsəyə imandan sonra ən üstün verilən nemət elə budur». Ömər b. AbdulƏziz – *rahmətullahi aleyhi* – deyir ki: «Əgər Allah bir bəndəsinə nemət verdikdən sonra neməti alaraq əvəzinə ona səbr verərsə bu alınan nemətdən daha xeyirlidir». Yəhyə b. Muaz – *rahmətullahi aleyhi* – deyir ki: «Əgər sən Rəbbini sevirsənsə və Rəbbin səni ac qoyarsa və çılpaq edərsə sənə vacibdir ki, buna səbr edib başqalarından da gizlədəsən. Çünkü sevən sevdiyinin əziyyətinə dözər». Ona görə də dünya müsibətləri onlarda nemətlər yerində idi. Onlardan biri deyir ki: «Bəlanı nemət saymayan və əmin-amanlığı da müsibət saymayan fəqih

deyildir». Onlardan digəri isə: «Mənim başıma bir müsibət gəldikdə 4 dəfə Allaha həmd edirəm. 1 Həmd edirəm ki, Allah bundan böyük müsibət verməyib. 2 Həmd edirəm ki, bu müsibətə qarşı səbr vermişdir. 3. Həmd edirəm ki, məni istircə: «***İnnə Lilləhi Və İnnə İleyhi Raciun***» kəlməsinə müvəffəq etdiyi üçün. 4. Həmd edirəm ki, bu müsibəti mənim dinimdə etməyib».

**10.** ***Allahın Məsləhət Bildiyində Xeyir Vardır***

***«Bəzən xoşlamadığınız bir şey sizin üçün xeyrli, bəzən də xoşladığınız bir şey sizin üçün zərərli ola bilər.*** *(Onu)* ***Allah bilir, siz bilməzsiniz».*** *(əl-Bəqərə 216).* Qədərin şirinliyini ancaq Allahın qəza və qədərinə inanan insan hiss edə bilər. Nəfsi rahat olar. Çox vaxt mömin insan şərrin baş verməsi haqqında düşünmür. İş baş verərsə, başına müsibət gələrsə onu fikirləri ilə bir daha da şişirtmir. Onu rahatlıqla qarşılayır və müsibətin itiliyini söndürür. Mömin insan şərri gözləməklə, şərri çoxaltmağı bir arada toplamır. Baş verən şeyləri rahatlıqla qarşılayır və bilir ki, Allahın təqdir etdiyində xeyir vardır və bunu Allah daha yaxşı bilir. ***"Möminlər*** *(müttəfiqlərin)* ***ordu hissələrini gördükdə dedilər: "Bu, Allahın və Peyğəmbərinin bizə olan*** *(zəfər)* ***vədidir.*** *(Biz bununla imtahana çəkilirik. Əgər bu imtahandan yaxşı çıxsaq, zəfər çalacağıq, çünki Allah və Peyğəmbəri həqiqi möminlərə kafirlər üzərində qalib olmağı vəd etmişlər)****. Allah və Peyğəmbəri düz buyurmuşlar!" Bu*** *(vəziyyət)* ***onların yalnız*** *(Allaha)* ***imanını və itaətini artırdı".*** *(əl-Əhzab 22).* Qəza və Qədərə iman gətirən müsəlman bir kimsə heç vaxt müvəffəqiyyətsizlik və məğlubiyyətdən sonra ruhdan düşməz, çünki o, qəti olaraq yəqindir ki, hər bir müvəffəqiyyətsizlik onu daha böyük itkidən və təhlükəli bəladan qurtarmışdır. O, götürdüyü səbəblər üzərində, öz halından və əməlindən düşünər. Əgər çata bimədiyi hədəf doğru, bu hədəfə çatmaq üçün istifadə etdiyi səbəblər halaldırsa bu zaman o, yeni güc və qüvvə ilə, Allaha ümüd və təvəkkül edərək bu işin asanlaşdırıl-masını diliyərək bu işə qol qoyar".

# İSLAM VƏ İMAN

İmanın həqiqətini bəyan edən bir çox dəlillər vardır ki, bununla bəndənin qəlbində iman ağacı kamilləşir. Bununla imanın səmərələrini görürlər və tamını, şirinliyini dadırlar. Bununla Allahın razılığını və Cənnətini qazanırlar. Bu o, naslardır ki, imanın həqiqətini və kamiliyyini bəyan edir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – İslam və İmanı məşhur Cəbrail – *əleyhissəlam* – hədisində zikr etdi. Belə ki, səhabələrin əhatəsində Cəbrail – *əleyhissəlam* – ondan İslam və İman barəsində soruşdu. Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, bir gün Rasulullah –*sallallahu aleyhi və səlləm* - in hüzurunda oturmuşduq. Bu vaxt paltarı düm ağ, saçları olduqca qara, üzərində səfər əlaməti görünməyən və aramızda hec kimsənin tanımadığı bir nəfər içəri girib, Peyğəmbər –*sallallahu aleyhi və səlləm* - in yanında oturdu. İki dizini onun dizlərinə söykəyib, əllərini (öz) dizlərinin üstünə qoyaraq: «Ey Muhəmməd! Mənə İslam haqqında xəbər ver!» deyə soruşdu. (Peyğəmbər): «(İslam) Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına, Muhəmmədın Allahın elçisi olduğuna şəhadət etmək, namaz qılmaq, zəkat vermək, Ramazanda oruc tutmaq, imkan olduqda Beyti həcc etməkdir» deyə buyurdu. (Adam): «Doğru söylədin!» deyə cavab verdi. (Ömər) dedi ki, adama heyrət etdik. Həm ona sual verir, həm də onun söylədiklərini təsdiq edirdi. (Adam): «Mənə İman haqqında xəbər ver!» deyə soruşdu. (Peyğəmbər): «(İman) Allaha, Mələklərinə, Kitablarına, Peyğəmbərlərinə, Axirət gününə və Xeyir və Şərrin Allahdan olmasına inanmaqdır» deyə buyurdu… (Peyğəmbər): «O, Cəbrail –

*əleyhissəllam* - idi. Sizə dininizi öyrətməyə gəlmişdi!» deyə buyurdu . Bu hədisdən İslam və İman arasında fərq olduğu aydın olur. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən İslam haqqında soruşduqda zahiri əməlləri zikr etmiş, İman barəsində soruşduqda isə qəlbi (batini) əməlləri zikr etmişdir. Bununlada elm əhli arasında ixtilaf yaranmışdır. Alimlər demişlər ki, İslam başqa bir şeydir, İman isə tam başqa bir şeydir.

İmanın həqiqəti bir dəlildən götrülmür. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu hədisdə İmana qəlbi (batini) əməlləri zikr etdi. Başqa bir hədisdə isə zahiri əməlləri imana vermişdir. Yəni İslama verdiyi tərifi başqa bir hədisdə İmana vermişdir. İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, AbdulQeys heyəti Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in hüzuruna gələrək dedilər: «Ya Rəsulullah! Bizlər Rabia qəbiləsindənik. Səninlə bizim aramızda Mudar kafirlərindən ibarət bir qəbilə maneə olmuşdur. Buna görə də sənin yanına yalnız Haram aylarda gələ bilirik. Buna görə də bizə qəti bir əmr ver ki, onu yerinə yetirək və həm də geridə qalanlara onu dəvət edək Cənnətə girək. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – onlara dörd şeyi əmr etdi və dörd şeydən də çəkindirdi. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir və tək olaraq Allaha iman etməyinizi əmr edirəm. Bir və tək olaraq Allaha iman etməyin nə olduğunu bilirsinizmi?» Onlar Allah və Rəsulu daha gözəl bilir!». O, buyurdu: «Allahdan başqa ilah olmadığına, Məhəmmədin onun Rəsulu olduğuna şəhadət etmək, namaz qılmaq, zəkat vermək və qənimətin **1/5**-ni verməkdir. Sizləri Dubbadan, Hantemdən, Nakirdən və Muzzafərdən çəkindirirəm» Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Cəbrail – *əleyhissəllam* - ın hədisində İslama verdiyi tərifi bu hədisdə İmana vermişdir. Elm əhli isə bu hədislərdən belə bir nəticəyə gəlmişlər ki, İslam və İmanın deyiliş forması vardır. Yəni bunların həm xüsusi və ümumi mənaları vardır. Ümumi mənası odur ki, bütün dini əhatə edir. Yəni İman ümumi mənada gələrsə bütün dini əhatə edir. Həmçinin də İslam ümumi mənada gələrsə bütün dini əhatə edir. Bəzi sözlər də belədir. Məs: Miskin və Fəqir. Allah: ***«Sədəqələr*** *(zəkatlar)* ***Allah tərəfindən müəyyən edilmiş bir fərz*** *(vacib əməl)* ***olaraq ancaq fəqirlərə,*** *(ehtiyacı olan, lakin utandığından əl açıb dilənməyən)* ***miskinlərə ….».*** *(ət-Tövbə 60).* Bir dəlildə həm fəqir, həm də miskin ləfzi işlədilmişdir. Bunun da hər birinin həm xüsusi, həm də ümumi mənaları vardır. Fəqir kəlməsi işləndiyi zaman onun içinə miskin də girər. Miskin kəlməsi də tək başına işləndiyi zaman onun içinə fəqir də girər. Lakin iksinin arası birləşdiyi zaman isə hər biri ayrı-ayrı mənaları ifadə edər. Fəqir sözü ayrı işlənərsə içərisinə miskin kəliməsi də daxildir. Həmçinin də Miskin sözü ayrı işlənərsə içərisinə fəqir kəliməsini də daxil edir. Lakin bir yerdə işləndiyinə görə ayrı-

---

[1699] Buxari 50, Müslim 8,10.

[1700] Bu heyət Hudeybiyyə sülhündən sonra Məkkə fəthindən bir az əvvəl Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəlmişlər. Heyətin böyüyü Munziru b. Aiz əl-Əsəri idi. Munzirin üzündə qılınc və ya bıçaq izi olduğu üçün Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onu əl-Eşecc diyə ləqəbləndirmişdir. Bundan sonra o, kimsə Abdulqays Eşecci ləqəbi ilə şöhrət tapmışdır. Heyəti sayı barəsində bir çox rəqəmlər vardır. 14, 40, 50 nəfərə qədər olduğu da söylənilir.

[1701] ***Haram Aylar – «Həqiqətən Allah yanında ayların sayı göyləri və yeri yaratdığı gündən bəri Allahın kitabında on ikidir. Onlardan dördü*** *(Rəcəb, Zülqədə, Zülhiccə və Məhərrəm)* ***haram aylardır. Bu doğru dindir. Ona görə də həmən aylarda özünüzə zülm etməyin. Müşriklərin hamısı sizinlə vuruşduqları kimi siz də onlarla vuruşun və bilin ki, Allah müttəqilərlədir!».*** *(ət-Tövbə 36).* Bu aylarda döyüşlər etmək, hücum etmək, ozünə zülm etmək qadağan edilmişdir. Məhz buna görə də bu ayları haram aylar adlandırırlar.

[1702] Bu adları çəkilən dörd kəlimə o, qövmün içərisində şərab düzəltdikləri qabların adlarıdır. ***Dubba –*** içi ovulmuş balqabaqdır, ***Hantəm –*** saxsıdan düzəldilmiş qabdır, ***Nakir –*** içi ovulmuş ağac parçasıdır ki, içərisinə kiçik xurmalardan atır. Sonra içərisinə su tökərdilər. Bir müddətdən sonra onu şərab olaraq alırdılar. ***Muqayyər –*** qır sürtülən qabdır. Buxari, Müslim.

ayrı mənaları vardır. Lakin baxmayaraq ki, onlar ehtiyacda müştərəkdilər. Yəni ehtiyac sahibidirlər. Yanaşı gəldiklərinə görə aralarında fərq vardır.

Lüğəti mənalarına görə İslam və İman ayrı-ayrı şeylərdir. Şəri mənaları ilə islam və iman bir-birindən ayrılmazdırlar. Biri digəri olmadan işlənməzlər. Əksinə harada səhih və mötəbər bir iman varsa onunla birlikdə islam da vardır və ya harada islam varsa onunla birlikdə iman da vardır. Onlardan hər hansı biri tək başına işlədiləcək olarsa, digəri də onun içərisinə girər və tək başına işlədilən bu isim yenə digər ismin tək başına işlədilməsi halında dəlalət etdiyi şeylərə dəlalət edər. Yəni İslam ləfzi tək gələrsə həm qəlbi (batini) əmlləri, həm də zahiri əməlləri əhatə edər. Həmçinin İman ləfzi də tək gələrsə həm zahiri, həm də qəlbi (batini) əməlləri əhatə edir. Çünki varlılıqları bir-birinə bağlıdır. Məs: ***«Ey iman gətirənlər! Namaz qılmağa durduğunuz zaman üzünüzü və əllərinizi dirsəklərinizə qədər*** *(və ya dirsəkləriniz də daxil olmaqla)* ***yuyun,*** *(yaş əlinizi)* ***başınıza məsh edin*** *(çəkin)**, ayaqlarınızı topuqlarınıza qədər*** *(topuqlarınız da daxil olmaqla)* ***yuyun».*** *(əl-Maidə 6)* - ayəsindəki xitab həm mömin, həm də müsəlmanları əhatə edir. Yoxsa ki, namaz üçün dəstəmaz almaq təkcə möminlər üçün deyildir. Müsəlmanların da dəstəmazsız namaz qılmaları mümkün deyildir. İman islamı əhatə etdiyi kimi, islam da imanı əhatə edir. Həmçinin: ***«Məni müsəlman olaraq öldür…».*** *(Yusif 101)* ayəsindəki ***«Məni müsəlman olaraq öldür!»*** eyni zamanda «Məni mömin olaraq öldür!» deməkdir. Yoxsa - məni müsəlman olaraq öldür, mömin olaraq öldürmə - mənasında deyildir. Çünki Allah bütün möminlərin ancaq müsəlman olaraq can verməlәrini ***«Ey iman gətirənlər! Allahdan lazımınca qorxun. Yalnız müsəlman olduğunuz halda ölün».*** *(Ali-İmran 102)* istər .

Həmçinin İmanla yanaşı saleh əməl, İslam, təqva, düz durmaq əmri gələrsə burada birinci yəni İmanla qəsd olunan qəlbi (batini) əməllərdir. O, biri ilə (saleh əməl, İslam, təqva və s.) qəsd olunan isə zahiri əməllərdir. Həmçinin də əl-Muminun, əl-Muminat sözü gəldikdə: «İman gətirib saleh əməl edən» deməkdir. Əgər «***Əl***» artikli ilə gələrsə əl-Muminun sözü: «***İlləzinə Əmənu Və Amilus Salihət***» deməkdir. Bu ayə də İmanla qəsd olunan batini, saleh əməl ilə zahiri əməllər qəsd olunur.

Əgər İman ümumi heç bir şeylə yanaşı gəlməzsə onda bütün dini əhatə edir. ***«…Lakin Allah sizə imanı sevdirmiş, onu ürəklərinizdə süsləmiş, küfrə, itaətdən çıxmağa və*** *(Allaha)* ***asi olmağa qarşı sizdə nifrət oyatmışdır. Məhz beləəri doğru yolda olanlardır!».*** *(əl-Hucurat 7).* Bu ayədə İman tək gəldiyi üçün Allah sizə nəyi sevdirdi? Dini. ***«Allah yanında*** *(məqbul olan)* ***din əlbəttə İslamdır…».*** *(Ali-İmran 19).* ***«Kim İslamdan başqa bir din ardınca gedərsə heç vaxt ondan qəbul olunmaz və o şəxs axirətdə zərər çəkənlərdən olar».*** *(Ali-İmran 85).* Burada İslam ilə qəsd olunan bütün dindir.

Lakin ikisi bir yerdə zikr olunarlarsa (islam və iman) aralarında fərq olur. Bu vəziyyətdə İman ilə görünməyən (batini) etiqadlar (inanclar) qəsd edilməkdədir. Bunlar isə Allaha, mələklərə, kitablara və Peyğəmbərlərə, axirət gününə, qəza və qədərə, xeyrinə və şərrinə iman etməkdir. Yəni bütün bunlar qəlbin təsdiq etməsi, iqrar etməsi və bilməsidir. İslam ilə, şəhadət gətirmək, namaz qılmaq, zəkat vermək, oruc tutmaq və həcc etmək kimi görünən ibadətlər yəni əməllərlə Allaha təslim olmaq, boyun əymək

---

[1703] İbn Məndə «İman» 1/448,454, Xattabi «Məalimus Sünən» 4/313, İbn Teymiyyə «İman» s. 148,222, «Məcmuul Fətava» 7/167,259,260, İbn Kəsr «Təfsirul-Quranil-Azim» 4/234, İbn Rəcəb «Cəmiul-Ulum vəl Hikəm» 1/107,108, Nəvəvi «Şərh Səhih Müslim» 1/144-149, İbn Əbil İzz əl-Hənəfi «Şərh Əqidətul Təhaviyyə» s. 347-351 və s. alimlər öz əsərlərində İslam və İmanın ayrı-ayrı (nass və ya cümlədə) işlənərlərsə (göstərdikləri məna baxımından) birləşərək bir-birinin yerini tutarlar.

və bağlanmaq qəsd edilməkdədir. Elm adamları buna belə deyirlər: «Hər mömin müsəlmandır, lakin hər müsəlman isə mömin deyildir». İbn Teymiyyə - *rahmətullahi aleyhi* – də İslam və İmana tərif verərək deyir ki, əgər bir dəlildə cəm olarsa məna tərəfdən ayrılırlar. Ayrı-ayrı gələrlərsə birləşirlər. Məs: Allah buyurur: ***«Bədəvi ərəblər: «Biz iman gətirdik!» dedilər.*** *(Ya Peyğəmbər! Onlara)* ***De ki: «Siz*** *(qəlbən)* ***iman gətirmədiniz! Ancaq: «Biz İslamı qəbul etdik!» deyin».*** *(əl-Hucurat 14).* İbn Abbas – *radıyallahu anhu* – deyir ki, onların bütünlüklə münafiq olmadığını, imanları zəif kimsələr olduğunu açıqlamışdır. İbn Cərir ət-Təbəri - *rahmətullahi aleyhi* – bu ayənin təfsirində deyir ki, Allah Rəsulu - *səllallahu aleyhi və səlləm* – bədəvi ərəblərin yalnız İslam (təslim) olduqlarını söyləməsini əmr etmişdi. Onlar yalnız dilləri ilə təsdiq etmiş, lakin qəlbləri ilə təsdiq etməmişlər. Buna görə də onlara yalnız İslam olduqları demələri əmr edildi. Çünki İslam (təslim) olmaq üçün söz yetərli olarkən, iman etmək üçün həm söz, həm də əməl gərəkdir. İbn Qeyyim - *rahmətullahi aleyhi* – bu ayənin təfsirində deyir ki: «Uca Allah bədəvilərin imanını inkar edərkən müsəlman olduqlarını, Ona və Rəsuluna itaət etdiklərini bildirmişdir. Kamil iman deyilərkən bu kəlimədə nə nəzərdə tutulursa ayədə o, rədd edilir . ***«Allah kimi düz yola yönəltmək istəsə, onun köksünü İslam*** *(dini)* ***üçün açıb genişləndirər. Kimi azdırmaq istəsə, onun ürəyini daraldıb sıxıntıya salar. O sanki*** *(sıxıntının şiddətindən)* ***göyə çıxar. Allah iman gətirməyənlərə pisliyi belə edər».*** *(əl-Ənam 125).*

Bu hədis Əhli Sünnə Vəl Cəmaatı imanın həqiqətinə dair gətirdiyi ən güclü dəlillərdəndir ki, İman zahiri əməlləri də əhatə edir. Çünki bu heyət haram aylarda gəlmələri ilə yanaşı Rəsulullah – *sallallahu aleyhi və səlləm* – dən böyük miqdarda bir el istəmişlər ki, ona əməl etsinlər və geridə qalanlara da çatdırsınlar. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – də onlara İmanın həqiqəti barəsində xəbər vermişdir.

## İSLAMDA İSTİSNA ETMƏK «İNŞƏALLAH, MƏN MÜSƏLMANAM» DEMƏK

İslamda istisna etmək bir kimsənin ***– İnşəallah Mən Müsəlmanam –*** deməsidir. Əhli Sünnə vəl Cəmaat istisnanı imanda caiz görürlər. İslamda isə caiz görməzlər. Çünki bildiyimiz kimi İslam iman deyildir. İmanın dərəcələri vardır. İnsanlar iman mərtəbəsində dərəcə-dərəcədirlər. Onlardan bir qrupu ehsan dərəcəsindədir, bir qrupu mömindirlər, bir qrupu da müsəlmandırlar. Bu da dərəcənin ən aşağısıdır. Ondan aşağı küfürdən başqa bir şey deyildir. Bir kimsə müsəlman deyilsə kafirdir. Lakin müsəlman olmayan kimsə müsəlman ola bilir. Çünki şəhadət kəlməsini söyləyən kimsə müsəlman olur və digər kafirlərdən fərqlənir. Beləcə onun haqqında İslamın hökümləri işlədilir.

Şəri dəlillər İslamda istisna etmədən – Mən müsəlmanam – deməyə dəlalət edir. ***«Allaha tərəf çağıran, yaxşı iş görən və mən müsəlman-lardanam deyən kəsdən daha gözəl danışan kim ola bilər»*** *(əl-Fussilət 33).* ***«Bədəvi ərəblər: «Biz iman gətirdik!» dedilər.*** *(Ya Peyğəmbər! Onlara)* ***De ki: «Siz*** *(qəlbən)* ***iman gətirmədiniz! Ancaq: «Biz İslamı qəbul etdik!» deyin. Hələ iman qəlblərinizə daxil olmamışdır. Əgər Allah və Peyğəmbərinə itaət etsəniz O, sizin əməllərinizdən heç bir şeyi əskiltməz. Həqiqətən Allah bağışlayan və rəhm edəndir».*** *(əl-Hucurat 14).* İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Bu ayə İmam Əhməd – *rahmətullahi*

---

[1704] İbn Qeyyim «Kitabu Salət» s. 25.
[1705] İcazə verilən.

*aleyhi* – və s. İslamda deyil, imanda istisna edilməsinin və böyük günah edənlərin iman mərtəbəsindən çıxıb islam mərtəbəsinə girdiklərinə dair sürdükləri dəlillərdəndir». əl-Meymuni dedi ki: «İmam Əhməddən - ***Mən İnşəallah Mömінəm*** – sözü haqqında fikrin nədir». O: «İnşəallah mömінəm deyirəm. Müsəlman deyərkən istisna etmərəm. Mən: «Sən, islam və iman arasında ayrım edirsən?» dedim. O: «Bəli» dedi. Mən: «Hansı dəlilə əsasən» dedim. O: «Bədəvilər biz iman etdik» dedilər. De ki: «Siz iman etmədiniz, müsəlman olduz deyin» .

## İMANDA İSTİSNA ETMƏK «İNŞƏALLAH, MƏN MÖMİNƏM» DEMƏK

Əhli Sünnə vəl Cəmaat imanda istisna etmək – yəni «İnşəallah, mən mömінəm» deməyin və özləri haqqında yəqin olaraq «Mən mömінəm» deməyin əleyhinədir. Bu isə onların Allahdan qorxmaları və qədərə iman etmələrinə görədir. Çünki heç kəs yəqin olaraq deyə bilməz ki, «mən mömінəm». Mütləq iman bütün itaətləri etməyi və bütün qadağaları tərk etməyi əhatə edir. İnsan bütün bunları etdikdə də yəqin olaraq bu kəlməni söyləməz. Əgər belə etsə onda özünü tərif etmiş, təmizə çıxarmış və özünü Allahdan haqqıyla qorxan, yaxın kimsələrdən olduğunu irəli sürmüş olur. Beləliklə də özünə yəqin olaraq mömin deyən kimsə özünün Cənnət əhlindən olduğunu da irəli sürməlidir. Bu isə mümkün deyildir. ***«Özünüzü təmizə çıxartmayın. O, Allahdan qorxub pis əməllərdən çəkinənin kim olduğunu daha gözəl bilir».*** *(ən-Nəcm 32).*

***İstisna Etmək*** – «İnşəallah, mən mömінəm» demək haqqında üç rəy vardır. Kimisi bunun vacib olduğunu, kimisi bunun haram olduğunu, kimisi də bu məsələdə orta yolu tuturlar.

Müxaliflərin qeyd etdiyinə görə iman tək bir şey olub əməl və sözdən ibarət deyildir. İman qəlbdəki təsdiqdir. Əgər qəlb təsdiq edirsə o, özünün mömin olduğunda da heç bir şəkk-şübhə etməməlidir. Onlara görə şahadət kəlməsini söylədiyimi bildiyim kimi, mömin olduğumu da bilirəm. Onların «Mən mömінəm» deməyi, «Mən müsəlmanam» deməyi kimidir və bu məsələdə «İnşəallah, mən mömінəm» deyənlərə də ***Şəkkak*** – şübhəçi adını verirlər.

İmam Əbu Hənifə – *rahmətullahi aleyhi* – də imanda inşəallah, mən mömінəm deməyin haram olduğu fikrindədir. O, deyir: «Mömin yəni inanan kimsə həqiqətən mömindir, kafir də həqiqətən kafirdir. Küfrdə şübhə olmadığı kimi imanda da şübhə yoxdur». Allah buyurur: ***«Onlar həqiqi möminlərdir».*** *(əl-Ənfal 4).* ***«Bütün bunlar həqiqətən kafirdilər».*** *(ən-Nisa 151).* Muhəmməd - *sallallahu aleyhi və səlləm* – in ümmətinin günahkar olan kimsələrinin hamısı həqiqətən mömin olub, kafir deyillər» . İmam Əbu Hənifə – *rahmətullahi aleyhi* –, Harisi və Haskəfinin rəvayətinə görə belə demişdir: «Alqamə ilə birlikdə Ata b. Əbi Rəbahın yanında idik». Alkamə ona: «Ey Əbu Muhəmməd! Ölkəmizdə imanlarını özlərinə nisbət etməyə və mən mömінəm deməyi xoş qarşılamayan bir qrup vardır» dedi. Ata b. Əbi Rəbah:

---

[1706] Məcmuu Fətava 7/253 – İman məxluqdur, yoxsa məxluq deyildir? Məsələsi haqqında: «Bu məsələ bidətçilərin və hava əhlinin çıxardığı ***Xalqul-Quran*** (Quran yaradılması) məsələsindən törənmişdir. Əhli Sünnə Quran Allahın kəlamı olduğuna, məxluq olmadığı görüşündə ittifaq etmişlər. Onun kəlamının sonu yoxdur. İman ilə ***Lə İləhə İlləllah*** – sözü kimi Allahın sifətindən və kəlamından bir şey qəsd edilirsə iman məxluq deyildir. İman ilə qulların əməllərindən və sifətlərindən bir şey qəsd edilirsə onda bütün qulları məxluqdur və onların bütün əməlləri də sifətləri də məxluqdur Məcmuu Fətava 6/313, 7/652, 8/422.

[1707] əl-Vəsiyyə s.87, əl-Fikhul Əbsat s. 41,43,52.

«Onlara nə olur ki, bunu söyləmirlər?» deyə qarşılıqlı sual verdi. Alkamə sözünə davam edərək: «Deyirlər ki, mömin olduğumuzu söylədikdə özümüzü Cənnət əhlindən olduğumuzu da qeyd edirik». Ata onlara: «Allah! Allah! Bu şeytanın hiylələrindən biridir. Şeytan onları Allahın onlara verdiyi ən böyük nemət olan İslamı tərk etməyə və bu xüsuslarda Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ə müxalif olmalarını vəsvəsə edir. Mən səhabələrin və eyni zamanda da Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in də bunu etdiyinin şahidi olmuşam» .

Digər bir qrup isə hər bir şeydə istisna etməyə başladılar və bu məsələdə həddi aşmışlar. Məs: Onlar etdikləri bütün saleh əməllərdə də istisna etməyə başladılar. «İnşəallah mən namaz qıldım, inşəallah oruc tutdum» və s. sözlər söyləməyə başladılar. Yenə onlardan bir çoxu hər şeydə istisna etməyə başladılar. «İnşəallah bu paltardır, inşəallah bu ayaqqabıdır» və s.

Lakin ən gözəl mövqe isə Sələfin mövqeyidir. Allah Qurani Kərimdə yəqin olaraq baş verən bəzi işləri Allahın diləməsinə bağlayaraq ifadə edildiyini açıq göstərən bir sıra ayələr vardır. Məs: ***«And olsun ki, Allah öz peyğəmbərinin*** *(Məkkə fəthi)* ***röyasının çin olduğunu təsdiq etdi.*** *(Ey möminlər!)* ***Siz, inşəallah əmin-amanlıq içində,*** *(bəziniz)* ***başınızı qırxdırmış,*** *(bəziniz)* ***saçınızı qısaltmış halda və*** *(müşriklərdən)* ***qorxmadan Məscidulharama daxil olacaqsınız».*** *(əl-Fəth 27).* ***O, yürüyüb-qaçmaq və atasına kömək edə bilmək çağına*** *(on üç yaşında)* ***çatdıqda*** *(İbrahim)* ***dedi: «Oğlum! Yuxuda gördüm ki, səni qurban kəsirəm. Bax gör*** *(bu barədə)* ***nə fikirləşirsən! O, dedi: «Atacan! Sənə nə əmr olunursa, onu da et. İnşəallah mənim səbrlilərdən olduğumu görəcəksən».*** *(əs-Saffat 102).* ***Və heç bir şey barəsində: «Mən onu sabah edəcəyəm! demə. Ancaq: «İnşəallah edəcəyəm» de.*** *(əl-Kəhf 23-24). (Yəqub və ailəsi)* ***Yusifin hüzuruna daxil olduqda o, ata-anasını bağrına basıb: «İnşəallah əmin-amanlıqla Misirə daxil olun» dedi.*** *(Yusif 99).* Aişə – *radıyallahu anhə* – rəvayət etdi ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – gecənin sonunda Bəqi qəbrsanlığına girər və deyərdi: «Ey möminlər topluluğunun yurdu! Salam üzərinizə olsun. Sizə vəd olunmuş (ölüm) gəlmişdir. İnşəallah biz də sizə qovuşacağıq. Allahım! Bəqi qəbrsanlığında yatanları bağışla!». Başqa rəvayətdə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ey möminlərin və müsəlmanların yatdığı yurdun sakinləri! Salam üzərinizə olsun! İnşəallah biz də sizə qovuşacağıq!» . Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər Peyğəmbərin qəbul edilmiş duası vardır. Hər peyğəmbər bu duasını etmişdir. Lakin mən duamı Qiyamət günündə ümmətimə şəfaət etmək üçün saxladım. Artıq ümmətimdən Allaha heç bir şeyi şərik qoşmamış olan kimsələr inşəallah bu şəfaətə nail olacaqlar» . Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Süleyman b. Davud (Allahın salamı iksinin də üzərinə olsun): «Şübhəsiz bu gecə yetmiş (Bəzi rəvayətlərdə **90**, bəzilərində **99**, bəzilərində **100**) zövcəmi (xanımlarımı) dolaşacağam. Zövcələrimdən hər biri Allah yolunda vuruşacaq bir süvari doğacaq» dedi. Bu an yoldaşı (olan mələk) Ona: «İnşəallah de!» dedi. Lakin o, İnşəallah deməyi unutdu. Bunundan sonra o, qadınlardan biri xaric, heç biri hamilə olmadı. O, da xəstə olan bir uşaq doğdu». Sonra

---

[1708] Xarizmi «Cəmiul Məsanid» 1/182, Aliyyul Kari – şərhu musnədi Əbu Hənifə s.378.
[1709] Müslim, İmam Əhməd 6/71,111,180, Nəsəi 4/93,94, İbn Məcə 1546, əl-Albani «Əhkəmul-Cənaiz» s. 239, «İrvəul Ğəlil» 3/236.
[1710] Buxari, Müslim.

Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Nəfsim əlində olan Allaha and olsun ki, əgər ***İnşəallah*** demiş olsaydı hər biri Allah yolunda vuruşacaq süvarilər doğardılar (Başqa rəvayətdə: Əgər ***İnşəallah*** demiş olsaydı vədini yerinə yetirmiş olardı və öz istəyinin yerinə yetməsi üçün daha çox ümüdü olardı)» .

Səhabələrdən gələn rəvayətlərdə: Əbul-Vahterinin (Səid b. Feyruz) rəvayətinə görə Əli – *radıyallahu anhu* – demişdir: «Bir kimsənin mən möminən deməsi bidətdir» . İbn Məsud – *radıyallahu anhu* – deyir: «Hər kim mömin olduğuna dair şahitlik edərsə, özünün Cənnətdə olduğuna da şahidlik etsin» . Bir nəfər İbn Məsud – *radıyallahu anhu* – nun yanında şübhəsiz ki, mən möminəm dedikdə İbn Məsud ona: «Onda mən Cənnətliyəm də de!» dedi. Sonra İbn Məsud – *radıyallahu anhu* – o, adama: «Lakin biz Allaha, Mələklərinə, Kitablarına, Peyğəmbərlərinə inanırıq» . Bir nəfər İbn Məsud – *radıyallahu anhu* – nun yanında şübhəsiz ki, mən möminəm deyir: «Ey Əbu Abdurrahmən! Bu adam mömin olduğunu iddia edir». İbn Məsud – *radıyallahu anhu* – onların bu sözlərinə: «Ondan bir soruşun görün o, Cənnətlikdir yoxsa Cəhənnəmlik?» Onlar həmin şəxsdən bunu soruşurlar. Adam da onlara: «Allah ən doğrusunu bilir». Adamın bu cavabından sonra İbn Məsud – *radıyallahu anhu* – ona: «İkincisini (yəni Cənnətlik və ya Cəhənnəmlik olduğunu) Allaha həvalə etdiyin kimi birincisini də Allaha həvalə etsəydin?» dedi» . İmam Əhməd – *rahmətullahi aleyhi* – ə imana dair sual verildikdə o: «İman - söz, əməl və niyyətdir!» deyə cavab vermişdir. Bu dəfə ona: «Adam sən möminsən?» deyə soruşarsa, o: «Bu bir bidətdir!» deyə cavab vermişdir. Bu səfər ona: «Yaxşı, beləsinə necə cavab verilir?» deyilincə, «İnşəallah, möminəm!» deyilir, deyə cavab vermişdir. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – qəbr əhlini ziyarət etdikdə buyurdu: «İnşəallah, biz də sizə qovuşacağıq!». O, burda istisna etdi. O, isə yəqin olaraq öləcəyini bildiyi halda istisna etdi» . Vəlid b. Müslim: «Əvzai, Məlik b. Ənəs və Səid b. AbdulƏzizin kişinin mən möminəm deməsini inkar etdiklərini, inşəallah mən möminəm deməsinə isə izn verdiklərini eşitdim» . İmam Beyhəqi – *rahmətullahi aleyhi* – deyir ki: «Bunu – imanda istisna etməyi – səhabədən bir qrupdan, tabiinlərdən və sələfi salihdən rəvayət etdik» . İbrahim ən-Nəhai – *rahmətullahi aleyhi* – deyir ki: «Bir kimsənin bir nəfərə – Sən möminsən – deyə soruşması bidətdir» . Sufyan b. Uyeynə – *rahmətullahi aleyhi* – deyir ki: «Bir kimsəyə sən möminsən deyə soruşulduğu zaman istəyirsə cavab verməsin və belə desin: «Sənin mənə belə bir sual verməyin bidətdir, mən imanımdan şübhə etmirəm. İman artar və əskilər. Mən möminəm inşallah deyəni isə tənqid etmə» . İmam əl-Acurri – *rahmətullahi aleyhi* – deyir ki: «Sözünü etdiyimiz elm adamlarından həqiqət əhlinin bir özəlliyi də imanda istisna etmələridir. Bu şübhə üzərində edilən bir istisna deyildir – imanda şübhədən Allaha sığınırıq – Lakin imanda kamil bir mənaya gələ biləcək şəkildə nəfislərini təzkiyə etməkdən qorxduqları və imanın həqiqətinə layiq kimsələrdən olub-olmadıqlarını bilmədikləri üçün edilən bir istisnadır. Bu səhabələrin

---

[1711] Buxari 5242, Müslim 1654, Nəsəi 7/30,31, İmam Əhməd 2/229,275,506, Tirmizi 1532.
[1712] Abdullah b. Əhməd «əs-Sünnə» 643, əl-Laləkai 1778.
[1713] Abdullah b. Əhməd «əs-Sünnə» 711,721, əl-Laləkai 1779.
[1714] Əbu Ubeyd «İman» 11, Abdullah b. Əhməd «əs-Sünnə» 655,668, Təbərani «əl-Kəbr» 9/8792, əl-Laləkai 1780.
[1715] əl-Albani – Əbu Ubeydin «İman» kitabında səhih olduğunu qeyd edir. S. 67.
[1716] əl-Laləkai «əs-Sunnə» 1798.
[1717] Abdullah b. Əhməd «əs-Sünnə» 687,744.
[1718] Beyhəqi «Şuabul İman» 1/212.
[1719] İbn Batta «əl-İbanə» 2/880 (1212).
[1720] İbn Batta «əl-İbanə» 2/881 (1213).

və onlara gözəl bir şəkildə uyanların yoludur» . İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Mütləq iman Allahın quluna əmr etdiyi şeylərin hamısını etməyi və haramları tərk etməyi əhatə edir. Bir kimsə: «Kimsə özünə mən mömınəm dediyi zaman əmr edilən bütün şeyləri yerinə yetirən və qadağaları tərk edən təqva sahibi yaxşılardan olduğuna şahidlik etmişdir. O, artıq Allahın vəlilərindən olur. Bu insanın bir növü öz nəfsini təzkiyə etməsi və bilmədiyi bir şeylə öz lehinə şahidlik etməsi deməkdir. Əgər bu şahidlik səhih olsaydı insanın bu hal üzərə ölməsi onun Cənnətlik olmasına da şahidlik etməsi lazım gəlir. Özünün Cənnətlik olmasına şahidlik edən heç kimsə yoxdur. Öz nəfsi üçün imanla şəhadət etməsi, bu hal üzərə ölürsə Cənnətlik olacağına şahidlik etməsi kimidir . İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «İbn Məsud və səhabələr, Sevri, İbn Uyeynə, Kufə alimlərindən bir çoxu, İmam Əhməd və sünnə imamları – *Allah onlardan razı olsun* - kimi hədis alimləri də imanda istisna edərdilər. Bu onlardan mütəvatir olaraq gəlmişdir» . Həmçinin səhabələrdən: «Ömər, İbn Məsud, Əli, tabiinlərdən - İbn Əbi Muleykə, Tavus, Həsənul-Basri, Məhəmməd b. Sirin, İbrahim ən-Nəhai, Səid b. Feyruz, Dəhhak b. Məşriki,İsmail b. Əbu Xalid, Muğirə b. Miksəm, fikhçilərdən Abdullah b. Şübrümə, Mamər b. Rəşid, Sufyan əs-Səvri, Sufyan b. Uyeynə, Abdullah b. Mubərək, İmam Məlik, İmam Əhməd – *Allah onlardan razı olsun* - və s. rəyləridir» .

# EHSAN

İslam dininin üçüncü mərtəbəsi - Ehsandır. Bu da tək bir rükndur. Peyğəmbər - *sallallahu aleyhi və salləm* -, onların yanına dinlərini onlara öyrətmək və Ehsan haqqında sual verməк üçün gələn Cəbrail – *əleyhissəlam* – a belə cavab vermişdi: «Ehsan, Uca Allahı sən Onu görür kimi ibadət etməkdir, lakin sən Onu görməsən də şübhəsiz ki, O səni görür». ***«O, Allah ki, səni namaza duranda da görür, səcdə edənlər içində olanda da. Həqiqətən** (hər şeyi)* ***eşidən və bilən odur!».*** *(əş-Şuəra 218-219).*

Ehsan pislik etməyin ziddidir. ***«Həqiqətən Allah ondan qorxub pis əməllərdən çəkinənlər və yaxşı işlər görənlərlədir».*** *(ən-Nəhl 128).* ***«Yaxşılığın əvəzi ancaq yaxşılığdır».*** *(ər-Rəhman 60).* ***«Yaxşı işlər görənləri Cənnət və daha artıq mükafatlar gözləyir. Onların üzlərinə nə bir toz, nə də bir zillət qonar».*** *(Yunus 26).* ***«Allah yolunda xərcləyin. Öz əlinizlə özünüzü təhlükəyə atmayın, yaxşılıq edin! Allah yaxşılıq edənləri sevər».*** *(əl-Bəqərə 195).*

Ehsanın içinə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in buyurduğu kimi; bir adamı miniyinə mindirmək, əşyalarını qaldırmaq və ya daşımaq üçün kömək etmək, ona yol göstərmək və s. buna bənzər xüsusiyyətlərin hamısı daxildir. Bunlar Allahın qullarına edilən yaxşılıqdır. Hətta bir kəsin Allahın qullarına bildiklərini öyrətməsi, dərs keçməsi və ya məclislərdə elmi söhbətlər etməsi xeyr və ehsandandır. Əbu Yə'la Şəddad b. Əus - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şübhəsiz ki, Allah hər şeydə ehsanı yazmışdır. Buna görə də öldürdüyünüz zaman gözəl şəkildə öldürün. Kəstiyiniz zaman gözəl bir şəkildə kəsin.

---

[1721] əl-Acurri «Kitabuş Şəriya» 2/656.
[1722] Məcmul Fətava 7/446.
[1723] İbn Teymiyyə «İman» s. 375, 394, «Məcmuul Fətava» 7/438-460.
[1724] Abdullah b. Əhməd «əs-Sünnə» 307-384, əl-Laləkai 5/967,968, Nəvəvi «Şərh Səhih Müslim» 1/150, Bəğavi «Şərhi Sünnə» 1/41.

Sizdən (heyvan kəsən şəxs) bıçağını yaxşıca itiləsin və kəsəcəyi heyvanı rahatlasın» . Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnsanların hər bir bədən üzvü üçün günəşin doğduğu hər bir gündə sədəqə vardır. İki nəfər arasında ədalətlə hökm verməк bir sədəqədir. Kişini miniyinə mindirmək üçün kömək etmək və yaxut da onun əşyalarını miniyə yükləmək üçün kömək etmək bir sədəqədir. Gözəl bir söz söyləmək bir sədəqədir. Namaz qılmaq üçün (məscidə) addımladığın hər bir addım bir sədəqədir. Yolda əziyyət verən bir şeyi götürmək də bir sədəqədir» .

Peyğəmbər– *sallallahu aleyhi və səlləm* – Ehsanın bir-birindən fərqli iki mərtəbədən ibarət olduğunu açıqlamaqdadır.

**1.** Uca Allaha sən Onu görür kimi ibadət etmək.

İbadətə gəlincə isə O, Allaha Onu görür kimi ibadət etmək deməkdir. Belə bir ibadət yəni insanın Rəbbinə Onu görür kimi ibadət etməsi istəklə və sevgi ilə edilir. Bu yolla insan sevdiyi və arzuladığı bir şeyi əldə etməyə çalışır. Çünki o, Rəbbinə Onu görür kimi ibadət edər. Beləliklə ona yönələr, Ona dönər və Ona yaxınlaşmağa çalışar.

**2.** Lakin sən Onu görməsən də, şübhəsiz ki, O səni görür.

Əgər sən Allaha onu görür kimi ibadət edə bilmirsənsə, onda Ona O, səni görür kimi ibadət et. Beləliklə Ondan qorxan, əzab və cəzasından qaçan kimsənin ibadəti kimi Ona ibadət etmiş olursan. İnsan Uca Allaha bu şəkildə ibadət etmiş olarsa Uca Allaha qarşı ixlaslı olar. İbadətini riyakarlıq və başqalarının eşitməsi üçün etməz, insanların onu təriflərnə-sini düşünməz. İnsanlar onun ibadətini istər bilsinlər, istər bilməsinlər onun üçün fərq etməz. Hətta ixlasın tamamlayıcı ünsürü də budur: «İnsan etdiyi ibadətini insanların görməməsinə və Rəbbinə qarşı etdiyi ibadətinin bir sir olaraq qalmasına diqqət edər».

## SƏLƏF İMAMLARININ ƏHLİ SÜNNƏ VƏL CƏMAAT HAQQINDA SÖZLƏRİ

**1.** Əbu Bəkr əs-Siddiq - *radıyallahu anhu* – deyir ki: «Sünnə Allahın sağlam ipidir. Onu tərk edən adam özü ilə Allah arasındakı ipi qoparır» .

**2.** İbn Ömər - *radıyallahu anhu* – deyir ki: «Sünnəni tərk edən kafir olur» .

**3.** İbn Məsud - *radıyallahu anhu* – deyir ki: «Allah qullarının qəlblərinə baxdı. Muhəmməd – *sallallahu aleyhi və səlləm* – in qəlbini qullarının qəlbləri arasında ən xeyirli qəlb olduğunu gördü. Buna görə də onu özü üçün (bir Peyğəmbər) olaraq seçdi və onu risalətlə göndərdi. Muhəmməd – *sallallahu aleyhi və səlləm* – in qəlbindən sonra yenə də qullarının qəlblərinə baxdı, onun səhabələrinin qəlblərini qullarının qəlbləri arasında ən xeyirli qəlblər olduğunu gördü. Buna görə də onları Peyğəmbərinə dini uğrunda vuruşacaq yardımçılar etdi. Buna görə də müsəlmanların gözəl gördükləri bir şey Allah dərgahında da gözəldir, pis gördükləri bir şey də Allah dərgahında da pisdir» .

---

1725 Müslim.
1726 Buxari, Müslim.
1727 İbn Batta «Şərhu əl-İbanə»s 120.
1728 İbn Batta «Şərhu əl-İbanə».
1729 İmam Əhməd «Musnəd» 1/379, Əhməd Şakir səhih.

**4.** Ömər - *radıyallahu anhu* – deyir ki: «Qurani Kərimin mütəşabihləri ilə sizlərlə mübahisə edəcək bir qrup kimsələr gələcəkdir. Siz də onları sünnətlərlə susdurun. Çünki sünnətə tabe olan kimsələr Allahın Kitabını ən gözəl bilən kimsələrdir» .

**5.** İbn Ömər - *radıyallahu anhu* – deyir ki: «Sizlərdən hər kimsə birinin sünnətini (yolunu) izləmək istəyərsə, ölmüş olanların (sünnətini) yolunu izləsin. Bunlar da Muhəmməd – *sallallahu aleyhi və səlləm* – in səhabələridir. Onlar bu ümmətin xeyirliləri idilər. Qəlbləri ən yaxşı, elmləri ən dərin, əbəs yerə özlərinə zülm etməkdən ən uzaq olan kimsələr idilər. Allah onları Peyğəmbərinə yoldaşlıq etməyə, dinini (daşımaq) başqalarına çatdırmaq üçün seçdi. Buna görə də sizlər də onların əxlaqı ilə əxlaqlanmaya və onların getdikləri yolla getməyə çalışın. Onlar Muhəmməd – *sallallahu aleyhi və səlləm* – in səhabələridirlər. Onlar Kəbənin Rəbbi olan Allaha and olsun ki, doğru yolda idilər» .

**6.** Xuzeyfə b. Yəmən - *radıyallahu anhu* – deyir ki: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in səhabələrinin ibadət deyə etmədiyi heç bir şeyi siz də ibadət deyə etməyin. Çünki əvvəl gələn, sonra gələnə söyləyəcək bir söz buraxmamışdır. Ey Alimlər topluluğu! Allahdan qorxun. Sizdən əvvəlkilərin izlədiyi yolu tutun» .

**7.** İbn Ömər - *radıyallahu anhu* – deyir ki: «İnsanlar əvvəlkilərin izlədikləri (yolu) izlədikcə doğru yolla getməyə davam edəcəklər» .

**8.** Əbu Dərda - *radıyallahu anhu* – deyir ki: «Sən əvvəlkilərin izini (yolunu) izlədiyin müddətdə əsla azmazsan» .

**9.** İbn Abbas - *radıyallahu anhu* – deyir ki: «Sünnət əhli olan bir kimsəyə baxmaq, sünnətə dəvət edər, bidəti isə qadağan edər» .

**10.** İbn Məsud - *radıyallahu anhu* – deyir ki: «Bizə Uca Allahın Kitabından və ya Allahın elçisinin sünnəsi ilə bağlı bildiyimiz hər hansı bir məsələ haqqında soruşsanız biz onu sizə çatdırarıq. Lakin sizin sonradan uydurduğunuz şeylərə biz cavab vermirik» .

**11.** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah hər bidət sahibinin tövbəsini o, bidətini tərk edincəyə qədər pərdə ilə əngələmişdir» .

**12.** Əbu İdris əl-Həvlani – *rahmətullahi aleyhi* – deyir ki: «Bir ümmət dində bir bir bidət ortaya çıxarsa mütləq Allah bu səbəbdən onlardan bir sünnəni götürər» .

**13.** Ubeyy b. Kəb - *radıyallahu anhu* – deyir ki: «Sizə o, yola və sünnəyə möhkəm sarılmağınızı tövsiyə edirəm. Çünki kim o, yolda və sünnədə olarsa Rəhmanı xatırladığı vaxt Onun qorxusundan gözləri yaşla dolarsa həmin adama Allah əzab verməz» .

**14.** Ömər - *radıyallahu anhu* – deyir ki: «Rəy əhli (Kitab və Sünnəyə əsaslanmayaraq öz rəyləri ilə hökm edənlər) sünnəyə müxalif olanlardır. Hədisləri yadda saxlamaq onlara çətin gəlmişdir. Onlar hədisləri tərk etdiklərinə görə onları yadda saxlaya bilməmişlər. Bunun nəticəsində öz fikirlərinə əsaslanaraq öz ağıllarına

---

[1730] əl-Laləkai «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Cəmaat», İbn Batta «əl-İbanə».
[1731] Əbu Nuaym «əl-Hilyə» 1/305.
[1732] İbn Batta «əl-İbanə».
[1733] əl-Laləkai «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Cəmaat».
[1734] İbn Batta «əl-İbanə».
[1735] əl-Laləkai «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Cəmaat».
[1736] Darimi 1/46.
[1737] əl-Albani «Səhih Tərğib vət Tərhib» 1/26 hədis 52.
[1738] ibn Vaddah «əl-Bidə» səh 36.
[1739] Əbu Nueym «Hiylə» 1/352-353, əl-Ləlakai 1/54.

uyğun söz söyləmişlər. Bununla da həm özləri azmışlar həm də başqalarını azdırmışlar» .

**15.** Əli - *radıyallahu anhu* – deyir ki: «Nəfsin istəyi sünnəyə müxalif olanın qənaətinə görə haqdır» .

**16.** İbn Məsud, Ubey b. Kəb - *radıyallahu anhum* – deyirlər ki: «Sünnədə iqtisad, bidətlərdə ictihad etməkdən xeyirlidir (yəni: az da olsa sünnə ilə əməl etmək çox bidətlə əməl etməkdən xeyirlidir) .

**17.** İbn Məsud - *radıyallahu anhu* – deyir ki: «Siz (sünnəyə) tabe olun. Bidət ortaya çıxarmağa çalışmayın. Çünki sünnə sizə kifayət edər, bidətə ehtiyac yoxdur» .

**18.** İbn Abbas - *radıyallahu anhu* – deyir ki: «Bir il keçməmiş insanlar bidəti ortaya çıxarmağa və sünnəni məhv etməyə başladılar. Nəhayət bidətlər yayılmağa, sünnə isə tərk olunmağa başladı» .

**19.** Əbu Zərr - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər –*sallallahu aleyhi və səlləm* – bizə üç şeyi tərk etməməyi əmr etdi: «Yaxşılığı əmr edib pislikdən çəkindirmək və insanlara sünnəni öyrətməyi» .

**20.** İbn Məsud - *radıyallahu anhu* – deyir ki: «Cəmaat Allaha itaətə uyğun gələn şey deməkdir, sən tək qalsan da belə» .

**21.** İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Biz hədis əhli deyərkən sadəcə onu duyan, yazan və rəvayət edənləri deyil, hədisi qorumağa çalışan, onun bilgisinə sahib olmağa, zahirdə və batində onu anlamağa və ona haqqıyla uymağa çalışanları qəsd edirik» .

**22.** İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki: «Cəmaatın içində xoşlanmadığınız bir şey şübhəsiz ayrılıq halında sevdiyiniz bir şeydən xeyirlidir» .

**23.** Usamə b. Şərik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allahın əli cəmaatın üzərindədir» .

**24.** İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allahın əli cəmaatla birlikdədir» .

**25.** İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər –*sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim əmrindən xoşuna gəlməyən bir şey görərsə, ona səbr etsin. Çünki şübhə yoxdur ki, cəmaatdan bircə qarış ayrılandan sonra ölən kimsə mütləq cahiliyyə ölümü ilə ölər» .

**26.** Zeyd b. Sabit - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər –*sallallahu aleyhi və səlləm* – buyurdu: «Üç xislət vardır ki, heç bir müsəlmanın qəlbi bunları yerinə yetirərkən qüsur göstərməz: «Əməli səmimi olaraq Allah üçün etmək, idarəçilərə nəsihət etmək və cəmaata bağlı qalmaq…» .

---

[1740] İbn Batta «Şərhu əl-İbanə» səh 121, İbn Həcər «Fəthul Bəri» 13/289, Laləkai 1/123.
[1741] İbn Batta «Şərhu əl-İbanə» səh 122.
[1742] Darimi 1/72, əl-Bəğavi «Şərhu Sünnə» 1/208, Həkim «Mustədrək» 1/103.
[1743] Darimi 1/69.
[1744] İbn Vaddah «əl-Bidə» səh 38.
[1745] Darimi 1/136.
[1746] Ləlakai 1/109.
[1747] Fətava 4/91-95.
[1748] Laləkai 1/108, əş-Şatibi «əl-İtisam» 2/261.
[1749] İbn Əbu Asim «əs-Sünnə» 1/40, əl-Albani səhih.
[1750] Tirmizi «Sünnən» 7/2166 həsən-qərib.
[1751] Buxari, Müslim.
[1752] İbn Əbu Asim «əs-Sünnə» 1/45, əl-Albani səhih.

**27.** Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir yerdə yemək yeyin və dağılmayın. Çünki şübhə yoxdur ki, bərəkət camaatla birlikdədir» .

**28.** İbn Abbas - *radıyallahu anhu* – deyir ki: «Kim uydurma adlardan birini qəbul edərsə, həmin adam İslam boyunbağısını boynundan çıxarmış sayılır» .

**29.** Bir nəfər bayram günü qəbristanlığda bayram namazından əvvəl namaz qılmaq istədi. Əli - *radıyallahu anhu* – isə ona mane oldu. Adam: «Ey möminlərin əmri! Mən bilirəm ki, Allah namaz qılmaqdan ötrü əzab etməyəcəkdir. Əli: «Mən də bilirəm ki, Allah, Allahın Rəsulu bir işi etmədikcə, yaxud da o, işin edilməsi üçün təşviq etmədikcə edənə savab verilmir. Bu durumda sənin qılacağın namaz əbəs bir iş olmuş olur. Əbəs iş etmək də haramdır. Bəlkə də Uca Allah Peyğəmbərə müxalif olduğun üçün bu əbəs işdən ötrü səni cəzalandırsın» .

**30.** Umm əd-Dərda - *radıyallahu anhə* – deyir ki, bir gün Əbu Dərda - *radıyallahu anhu* – qəzəbli halda mənim yanıma girdi. Mən: «Sənə nə olub ki, belə qəzəblisən?» dedim. O: «Allaha and olsun ki, mən bilmirəm bu insanlarda camaat namazına yığılmaqdan başqa Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən nə qalıb» .

**31.** İbn Məsud - *radıyallahu anhu* – deyir ki: «Sonradan ortaya çıxan bidətlərdən özünüzü qoruyunuz. Çünki din qəlbdən heç bir zaman bir dəfəyə silinməz. Lakin şeytan sizlər üçün qəlbdən imanı büstbütün silənə qədər bidətlər ortaya qoyar».

**32.** İbn Abbas - *radıyallahu anhu* – deyir ki: «Bidət əhli olanlarla oturub qalxma, çünki onlarla oturub qalxmaq qəlbləri xəstə edər» .

**33.** Muaz b. Cəbəl - *radıyallahu anhu* – deyir ki: «Ey insanlar! Elm qaldırılmadan əvvəl elm öyrənməyə çalışın. Onu da bilin ki, elmin qaldırılması elm əhli olan kimsələrin getməsidir. Bidətlərdən, bidət ortaya qoymaqdan çəkinin. Həddi aşmaqdan çəkinin, siz öz halınıza baxın» .

**34.** İbn Ömər - *radıyallahu anhu* – deyir ki: «Hər bir bidət sapıqlıqdır. İstərsə insanlar onu gözəl görsünlər» .

**35.** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim bidət etsə və ya bidətçini gizlətsə onu Allah, mələkləri və bütün insanlar lənətləyəcəklər» .

**36.** Əli - *radıyallahu anhu* – deyir ki: «Əgər din ağıla görə olsaydı (xufun) alt tərəfinin məst edilməsi, üst tərəfin məst edilməsindən daha uyğun olardı. Lakin mən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in (xufun) üst tərəfinə məst etdiyini gördüm» .

**37.** Abdullah b. Ömər - *radıyallahu anhu* – ya bir məsələ haqqında sual verib sonra da atan (Ömər) bunu qadağan etmişdir deyən bir kimsəyə belə cavab vermişdir: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in əmrinə uymaq daha uyğundur, yoxsa atamın əmrinə?» .

---

[1753] İbn Məcə 3287, 2/1093,1094, əl-Albani «Səhih əl-Cəmi» 4/168.
[1754] İbn Batta «Şərhu əl-İbanə» səh 137.
[1755] «Məcmuul Bəhreyn».
[1756] Buxari.
[1757] Laləkai «Şərhu Usulu Etiqad Əhli Sünnəti vəl Camaat».
[1758] İbn Vaddah «əl-Bidə».
[1759] Laləkai «Şərhu Usulu Etiqad Əhli Sünnəti vəl Camaat».
[1760] Buxari 4/73, Müslim 1371.
[1761] İbn Əbi Şeybə «Musənnəf»
[1762] İbn Qeyyim «Zədul Məad».

**38.** Abdullah b. Ömər - *radıyallahu anhu* – səhabələr içərisində sünnətə çox bağlı bir kimsə idi. Bir nəfər asqırıb: «***Əlhəmdulilləhi Vəs Salətu Vəs Saləmu Alə Rəsulullah***» dedikdə İbn Öəmr: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bizə belə öyrətdi. Sizdən biri asqıranda ***Əlhəmdulilləhi Alə Kulli Hal*** desin. Peyğəmbərə salət və salam gətirsin demədi» .

**39.** İbn Abbas - *radıyallahu anhu* – sünnətə qarşı ona təməttu həcci haqqında soruşana demişdir: «Belə getsə çox keçməz ki, səmadan üzərinizə daşlar yağar. Mən sizə deyirəm ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – belə buyurdu deyirəm, sizlər də mənə Əbu Bəkr və Ömər belə dedilər, deyirsiniz» .

**40.** Ömər - *radıyallahu anhu* – deyir ki: «Mən insanların nə zaman islah olub, nə zaman işlərinin pozulacağını bilirəm. Əgər kiçik yaşdakılar anlayış sahibi olurlarsa böyüklər bu işin içindən çıxmazlar. Lakin yaşı ötmüş kimsələr məsələləri qavrayarlarsa, kiçiklərdə onlara uyarlarsa hər iksi də hidayət taparlar» .

**41.** İbn Məsud - *radıyallahu anhu* – deyir ki: «İnsanlar elmi böyüklərdən öyrəndikləri müddətdə xeyir içində qalmağa davam edərlər. Onu kiçiklərdən və şərlilərdən öyrənməli olarlarsa onda həlak olurlar» .

**42.** İbn Məsud - *radıyallahu anhu* – deyir ki: «Möminə hər cür damğa vurula bilər, yalnız xainlik və yalançılıq damğası vurulmaz» .

**43.** Ubey b. Kəb - *radıyallahu anhu* – deyir ki: «Mömin dörd şeyin arasındadır. Bəla və müsibətlə qarşılaşarsa səbr edər, ona bir şey verilərsə şükr edər, bir şey söyləyərsə doğru söyləyər, bir hökm verərsə ədalətli olar» .

**44.** Abdullah b. Məsud - *radıyallahu anhu* – deyir ki: «Cəmaat haqqa uyğun olandır. Tək də olsan haqqa uyğun hərəkət edirsən. Bil ki, cəmaat sənsən» .

**45.** Qudayf b. əl-Hərisdən - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir qövm bir bidət ortaya çıxarsa mütləq sünnədən bir o, qədəri yox olar» .

**46.** Sufyan əs-Səuri – *rahmətullahi aleyhi* – deyir ki: «Sünnəyə tabe ol və bidəti tərk et» .

**47.** Avn b. Abdullah – *rahmətullahi aleyhi* – deyir ki: «Hər kim İslam və Sünnə üzrə ikən ölərsə artıq hər cür xeyrin müjdəsi onun üçündür»

**48.** Sufyan əs-Sövri – *rahmətullahi aleyhi* – deyir ki: «Gün çıxan tərəfdən olan bir adamın sünnətə bağlı olduğuna dair sənə bir xəbər çatarsa, sən də ona salam göndər. Çünki sünnət əhli (sünnətə bağlı) kimsələr azalmışdır» .

**49.** Malik b. Miğəl – *rahmətullahi aleyhi* – deyir ki: «Əgər bir kimsə İslam və Sünnədən başqa bir adla xatırlanarsa sən onu istədiyin dinə nisbət edə bilərsən» .

---

[1763] Tirmizi 2738, əl-Albani “Həsən”.
[1764] AbdurRazzaq «Musənnəf».
[1765] İbn Əbdil Bərr «Cəmiu bəyanil ilm» s. 247.
[1766] İbn Əbdil Bərr «Cəmiu bəyanil ilm» s. 248.
[1767] İbn Əbi Şeybə «Kitabul İman» s. 35 əl-Albani səhih.
[1768] Əbu Nuaym əl-Əsfəhani «Hiylətul Övliya» 1/255.
[1769] əl-Laləkai «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Cəmaat» 1/108-109.
[1770] Əhməd «Musnəd» 4/105, Süyuti «Cəmius Səğir» 2/480 № 7790, əl-Albani «Daifu Cəmius Səğir» 5/78 № 4985 - zəif. Lakin Həsən b. Atiyyədən gələn rəvayət isə səhihdir əl-Albani «Mişkətul Məsabih» 1/66.
[1771] əl-Bəğavi «Şərhu Sünnə» 1/217.
[1772] Laləkai 1/67.
[1773] Laləkai «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Cəmaat».
[1774] İbn Batta «Şərhu əl-İbanə» səh 153.

**50.** əl-Auzai – *rahmətullahi aleyhi* – deyir ki: «Beş şey var ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in səhabələri ondan ayrılmamışlar. Camaata qatılmaq, sünnəyə tabe olmaq, məscidi abadlaşdırmaq, Quran oxumaq və Allah yolunda cihad etmək…» .

**51.** əz-Zuhri – *rahmətullahi aleyhi* – deyir ki: «Bizim gəlib getmiş elm adamlarımız Sünnəyə möhkəm sarılmaq qurtuluşdur – deyərdilər» .

**52.** Əyyub əs-Şahtiyani – *rahmətullahi aleyhi* – deyir ki: «Mənə sünnət əhlindən olan bir nəfərin ölüm xəbəri gəlib çatdıqda sanki orqanlarımdan birini itirmiş kimi oluram» .

**53.** Abdullah b. Mübarək – *rahmətullahi aleyhi* – dən camaat haqqında soruşduqda o, belə cavab vermişdir: «Əbu Bəkr və Ömər» – dir demişdir. Ona: «Əbu Bəkr və Ömər» vəfat ediblər deyə soruşanda, bu dəfə: «Filan və filankəsdir» demişdir. Yenə onların vəfat etdiyini xəbər verdikdə o: «Həmzə əs-Sukkəri bir camaatdır» .

**54.** Abdullah b. Mubarək – *rahmətullahi aleyhi* – deyir ki: «Ey qardaşım! Bunu da bil ki, bu gün sünnətə sarılaraq ölmək Allahın hüzuruna çıxacaq hər bir müsəlman üçün bir lütf, bir mərhəmətdir» .

**55.** Əbu Məsud əl-Əşaridən - *radıyallahu anhu* – dan fitnə ilə bağlı sual soruşduqda demişdir: «Sən camaatla birgə olmağa çalış. Şübhəsiz Allah Muhəmməd – *sallallahu aleyhi və səlləm* – in ümmətini zəlalət üzrə bir yerə yığmaz. Təfriqəçilikdən çəkin, şübhəsiz təfriqə zəlalətin özüdür» .

**56.** əl-Fudayl b. İyad – *rahmətullahi aleyhi* – deyir ki: «Şübhəsiz Allah onların vasitəsi ilə ölkələrə hidayət verdiyi qulları vardır. Bunlar sünnət əshabı olan kimsələrdir» .

**57.** Abidə b. Ömər əs-Sələmi – *rahmətullahi aleyhi* – Əli - *radıyallahu anhu* – belə demişdir: «Camaat halında sənin və Ömərin fikri, ayrılıq halında sənin tək başına olan fikrindən daha çox xoşuma gəlir» .

**58.** əl-Albani – *rahmətullahi aleyhi* – deyir ki: «İslam dövlətini qəlbinizdə qurun ki, Allah da onu sizin üçün o, yer üzündə qurulsun».

**59.** İmam Şafii – *rahmətullahi aleyhi* – deyir ki: «Mən hədis əhlindən bir kimsəni gördümmü sanki Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in səhabələrindən birini görür kimi oluram» .

**60.** Amr b. Qeys əl-Mulai – *rahmətullahi aleyhi* – deyir ki: «Əgər sən bir gəncin əvvəldən (ilk yetişdiyi andan etibarən) Əhli Sünnə vəl Camaatla birlikdə yetişdiyini görsən bil ki, ondan (xeyirli şeylər) uma bilərsən. Əgər bidət əhli ilə birlikdə olduğunu görsən ondan ümüdünü kəs. Çünki gənc adam birinci dəfə necə yetişərsə o, cür də olacaq» . Başqa bir yerdə: «Cavan yetişir. Əgər elm əhli ilə oturub durmağı seçirsə,

---

[1775] əl-Bəğavi «Şərhu Sünnə» 1/217.
[1776] Darimi «Sünnən» 1/45, Ləlakai 1/94.
[1777] Laləkai «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Camaat».
[1778] Bəğavi «Şərhu Sünnə» 1/216.
[1779] İbn Vaddah «əl-Bidau vən Nəbyu Anhə».
[1780] əş-Şatibi «əl-İtisam» 2/261.
[1781] Laləkai «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Camaat».
[1782] «Fəthul Bəri» 7/73.
[1783] Xatib «Şərəfu Əshəbu Hədis».
[1784] Laləkai «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Camaat», İbn Batta «Şərhu əl-İbanə».

qurtulması ehtimalı böyükdür. Əgər başqalarına meyl edəcəksə, həlak olma ehtimalı böyükdür».

**61.** İmam Malik – *rahmətullahi aleyhi* – deyir ki: «Bu ümmətin başı nə ilə islah olunmuşsa, bu ümmətin sonu da ancaq onunla islah olunur (düzəlir). O, gün din olmayan heç bir şey bu gün də din olmaz».

**62.** Abdullah b. Mubarək – *rahmətullahi aleyhi* – deyir ki: «Güvənib dayandığın əsər (əvvəlkilərin yolu) olsun».

**63.** İbn Şəvzəb – *rahmətullahi aleyhi* – deyir ki: «Gəncin ibadətə yönəldiyi vaxt sünnə sahibi olan bir insanla rastlaşması Allahın nemətlərindəndir».

**64.** Əbu Sələmə b. AbdrRahmən Həsənul Bəsriyə demişdir: «Mənə sənin özündən fətva verdiyini söylədilər. Allah Elçisinin – *sallallahu aleyhi və səlləm* – in sünnəsi və ya Allah tərəfindən göndərilmiş kitabın hökmü ilə olmasa heç vaxt öz fikrinə görə fətva vermə».

**65.** İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «İmamların birindən sünnə haqqında soruşduqda o, belə demişdir: «Mənim sünnədən başqa heç bir adım yoxdur».

**66.** Muafa b. İmran – *rahmətullahi aleyhi* – deyir ki: «İnsanı öləndən sonra tərif et. Çünki ölənə qədər onun sünnə və ya bidət üzərə öləcəyi bilinməz».

**67.** Meymun b. Mihran – *rahmətullahi aleyhi* – deyir ki: «İslamdan başqa adlandırılan hər bir addan çəkin».

**68.** Əbu Bəkr əl-Əyyaş – *rahmətullahi aleyhi* – dən sünnə əhli kimdir? deyə soruşduqda o, dedi: «Nəfsin müxtəlif istəklərindən bəhs ediləndə onların heç birinə tərəfdər olmayandır».

**69.** Əyyub əs-Səhtəyani – *rahmətullahi aleyhi* – deyir ki: «Əhli Sünnənin ölümünü istəyən adamlar əslində ağızları ilə Allahın nurunu söndürmək istəyənlərdir. Ancaq kafirlər istəməsələr də Allah nurunu tamamlayacaqdır».

**70.** Həssən b. Atiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Cəbrail Allah Elçisinə – *sallallahu aleyhi və səlləm* – ə Quranı gətirdiyi kimi sünnəni də gətirdi».

**71.** Fudeyl b. İyad – *rahmətullahi aleyhi* – deyir ki: «Gördüyüm bütün xeyirli insanlar sünnəyə bağlı kimsələr idilər və bidət sahiblərindən uzaq qalmağı əmr edərdilər».

**72.** İmam Şafii – *rahmətullahi aleyhi* – deyir ki: «Sünnətə müxalif olaraq haqqında söz söylədiyim nə qədər məsələ varsa mən ondan həyatımda olsun, ölümümdən sonra olsun vaz keçirəm».

**73.** Həsənul Bəsri – *rahmətullahi aleyhi* – deyir ki: «Şübhəsiz ki, sünnə əhli olan kimsələr insanlar arasında say etibarı ilə ən az olanlardır. Yerdə qalan insanlar arasında

---

[1785] İbn Batta «Şərhu əl-İbanə» 1/206.
[1786] Kadi İyad «əş-Şifa» 2/88.
[1787] Beyhəqi «Sünənul Kubra».
[1788] İbn Batta «Şərhu əl-İbanə» səh 133, «əl-İbanə» 1/205.
[1789] Darimi 1/59.
[1790] «Mədaricus Salihin» 3/174.
[1791] Laləkai «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Cəmaat».
[1792] İbn Batta «Şərhu əl-İbanə» səh 137.
[1793] Laləkai 1/60,65.
[1794] Laləkai 1/61.
[1795] İbn Batta «Şərhu əl-İbanə» səh 128, İbn Teymiyyə «Məcmuə əl-Fətava» 3/366.
[1796] İbn Batta «Şərhu əl-İbanə» səh 153.
[1797] Xatib «əl-Fakibu vəl Mutefakkib».

da insanların ən az olanlarıdır. Onlar kef və dəbdəbə içində olanlarla kef və dəbdəbələrində iştirak etməzlər, bidət əhlinin də bidətlərinə qarışmazlar. Rəbblərinə qovuşana qədər sünnə üzərində sabit qalarlar. Siz də Allahın izni ilə belə olun» .

**74.** Rabi b. Süleyman deyir ki: «İmam Şafii bir gün bir hədis rəvayət etdi. Bir nəfər: «Ey Abdullahın atası! Sən bunu qəbul edirsən?» deyincə Şafii: «Mən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən gələn səhih bir hədis rəvayət edib və onu qəbul etməmiş olsam siz şahid olun ki, mən ağlımı başımdan itirmişəm» .

**75.** Fudeyl b. İyad – *rahmətullahi aleyhi* – deyir ki: «Bidət sahibi olan bir kimsəyə dinə aid olan məsələlərdə heç vaxt güvənmə. İşlərində onunla istişarə (məşvərət) etmə. Onun yanında oturma. Bidət sahibi olan kimsənin yanına oturan bir kimsənin qəlbini Uca Allah kor edər» .

**76.** Abdullah b. Mubarək – *rahmətullahi aleyhi* – deyir ki: «Allahım bidət əhlindən olan bir kimsənin mənə bir yaxşılıq etməsindən və sonda mənim qəlbimin ona sevgi bəsləməsinə imkan vermə» .

**77.** Sufyan əs-Səvri – *rahmətullahi aleyhi* – deyir ki: «Hər kim bir kimsənin bidət sahibi olduğunu bildiyi halda o, kimsəyə qulaq verib (onu dinləyərsə) Allahın onu qoruması üzərindən qalxar və öz halına buraxılar» .

**78.** İmam əl-Əvzai – *rahmətullahi aleyhi* – deyir ki: «Bidət sahibi olan bir kimsənin mübahisə etməsinə imkan verməyin. O, vaxtı fitnəsi səbəbiylə qəlbinizə şübhə düşər» .

**79.** Məlik b. Ənəs – *rahmətullahi aleyhi* – deyir ki: «Bidət əhli kimsə ilə nigahlanmaz, bidət əhli kimsəyə qız verilməz və onlara salam verilməz» .

**80.** İmam Şəfii – *rahmətullahi aleyhi* – deyir ki: «Ya xeyir də bizə qonşuluq edərsiniz, ya da qalxıb gedərsiniz» .

**81.** Abdullah b. əd-Dəyləmi – *rahmətullahi aleyhi* – deyir ki: «Təcrübəmdən bildiyimə görə dinin yox olması sünnəni tərk etməklə başlanır» . Başqa bir yerdə isə o, demişdir: Bir parçanın süzülməsi kimi, sünnə də yavaş-yavaş unudulacaqdır» .

**82.** Həsənul Bəsri və əbu Sufyan – *rahmətullahi aleyhi* – deyir ki: «Uca Allahın: ***«Sonra səni də dində şəriət sahibi etdik. Sən də o, şəriətə tabe ol…»*** *(əl-Casiyə 18)* buyurduğunu: «Sünnə üzrə etdik» deyə açıqlamışlar .

**83.** İmam Əbu Xatim əl-Hənzəli ər-Razi – *rahmətullahi aleyhi* – deyir ki: «Bidət əhlinin əlaməti rəvayət alimlərinə dil uzatmaqdır. Zındıqların əlaməti isə rəvayət elmi ilə məşğul olanlara Haşviyə adını vermələridir. Onlar beləliklə rəvayətləri yox etmək istədilər. Cəhmiyənin əlaməti isə Əhli Sünnətə müşəbbih adını vermələridir. Qədəriyənin əlaməti Əhli Sünnətə Cəbriyəçilər adını vermələridir. Murciyənin əlaməti Əhli Sünnətə müxaliflər, nöqsançılar adını vermələridir. Rafizilərin əlaməti Əhli

---

[1798] Darimi 1/72.
[1799] İbn Batta «əl-İbanə».
[1800] Laləkai «Şərhu Usulu Etiqad Əhli Sünnəti vəl Cəmaat».
[1801] Laləkai «Şərhu Usulu Etiqad Əhli Sünnəti vəl Cəmaat».
[1802] İbn Vaddah «əl-Bidə».
[1803] İbn Vaddah «əl-Bidə».
[1804] İmam Məlik «Mudəvvənətul Kubra».
[1805] Nəsir b. İbrahim Məqdisi «Mubtasaru Kitabil Huccəti alə Tərkil Məbaccəti».
[1806] Darimi 1/45, ibn Vaddah «əl-Bidə» səh 38.
[1807] İbn Vaddah «əl-Bidə» səh 66.
[1808] Laləkai 1/69.

Sünnətə Nəvasiv adını vermələridir. Əhli Sünnətə isə yalnız bir ad uyğun düşə bilər. Bütün bu isimlərin onlar haqqında istifadə edilməsinə yer yoxdur» .

**84.** Əyyub əs-Sahtiyani – *rahmətullahi aleyhi* – deyir ki: «Şübhəsiz ki, bidət əhli sapıq kimsələrdir. Görüşümə görə onlar ancaq Cəhənnəmə gedəcəklər» .

**85.** Kadi Əbu Yusuf – *rahmətullahi aleyhi* – deyir ki: «Mən Cəhmiyənin, Rafizinin və Qədəriyəçi olan bir kimsənin arxasında namaz qılmaram» .

**86.** İmam Abdurrahmən b. Mehdi – *rahmətullahi aleyhi* – deyir ki: «İnsanlar müxtəlifdir. Bəziləri sünnədə də hədisdə də imamdır. Bəziləri isə təkcə hədisdə imamdırlar. Sünnə və hədisdə imam olan şəxs isə Sufyan əs-Səuridir» .

**87.** İmam əl-Berbehari – *rahmətullahi aleyhi* – deyir ki: «Sən bir kimsənin rəhbərə qarşı bəd dua etdiyini görsən bil ki, o bidət sahibidir. Əgər bir kimsənin rəhbərin islah olması üçün dua etdiyini görsən bir ki, o – *Uca Allahın izniylə* – sünnətə bağlı bir kimsədir» .

**88.** Fudeyl b. İyad – *rahmətullahi aleyhi* – deyir ki: «Əgər mənim qəbul ediləcək bir duam olsaydı bunu mütləq rəhbər üçün ayırardım. Çünki bizlər onların islah olunmaları üçün dua etməklə əmr olunduq, onlara bəd dua etməklə isə qadağan olunduq. İstərsə haqsızlıq etsinlər, istərsə zülm. Çünki onların zülm və haqsızlıqları öz əleyhlərinədir. Salamat olmaları isə həm özlərinə, həm də müsəlmanların lehinədir. Digər tərəfdən onların islah olunmaları ilə ümmət də islah olur. Çünki mənim salehliyim yalnız özümün, başçıların salehliyi isə bütün müsəlmanların xeyrinədir» .

**89.** Həsənul Bəsri – *rahmətullahi aleyhi* – deyir ki: «Onu da bil ki – *Allah sənə rəhm etsin* – hökmüdarların zülmləri Allahın intiqamlarından bir intiqamdır. Uca Allahın intiqamlarına da qılıncla qarşılıq verilməz. Bu intiqamlar dua, tövbə, Allaha dönüş, günahlardan çəkinmək ilə bir tərəf edilir və silinir. Allahın itiqamı qılıncdan daha da kəskindir» . Başqa bir rəvayətdə: «Həsənul Bəsri – *rahmətullahi aleyhi* – Həccaca bəd dua edən bir kimsənin sözlərini eşitdikdə belə demişdir: «Bunu etmə, Allah sənə rəhmət etsin. Əslində bu müsibətlər sizə öz əllərnizlə etdiklərnizdən ötrü gəlmişdir. Biz qorxuruq ki, Həccac əsr edilir və ya ölürsə, meymunlar və donuzlar gəlib sizə rəhbər olurlar» .

**90.** İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir ki: «Müsəlman rəhbərlərə nəsihətə gəlincə, haqq üzərə onlara yardım etmək, bu xüsusda onlara itaət etmək, yumşaqlıqla və uyğun bir dillə onlara haqqı əmr etmək, onları başa salmaq, öyüd vermək və unutduqları şeyləri onlara təkrar bildirməklə olur» .

**91.** İbnul Məcisun deyir ki, İmam Malikin belə dediyini dinlədim: «Hər kim İslamda gözəl görərək bir bidət ortaya çıxararsa, Məhəmməd – *sallallahu aleyhi və səlləm* – in risalətinə qarşı xainlik etdiyini iddia etmiş olur. Çünki Uca Allah: ***«Bu gün dininizi tamamlayıb mükəmməl etdim….».*** *(əl-Maidə 3)* deyə buyurdu. Bu baxımdan da o, gün din olmayan heç bir şey bu gün də din olmaz» .

---

[1809] ər-Razi «Aslus Sünnəti Vatiqadud Din».
[1810] İbn Batta «əl-İbanə».
[1811] Laləkai «Şərhu Usulu Etiqad Əhli Sünnəti vəl Cəmaat».
[1812] «Cərhu ət-Tədil» 1/118, Laləkai 1/63 müqddimə.
[1813] «Şərhu Sünnə» s. 116.
[1814] «Şərhu Sünnə» s. 114, Əbu Nueym «Hiylətul Övliya» 8/91.
[1815] İbnul Cövzi «Ədəbul Həsənul Bəsri» s. 119.
[1816] İbnul Cövzi «Ədəbul Həsənul Bəsri» s. 119.
[1817] Şərhu Səhih Müslim 2/241.
[1818] Şatibi «əl-İtisam».

**92.** İbrahim ən-Nəhai – *rahmətullahi aleyhi* – deyir ki: «Əgər Muhəmmədin səhabələri bir dırnağı belə məst etmişlərsə mən də onlara uymağın fəzilətini əldə etmək üçün (ayağımı) yumazdım» .

**93.** Xəlifə Ömər b. AbdulƏziz – *rahmətullahi aleyhi* – deyir ki: «O, qövmün durduğu yerdə sən də dur. Çünki onlar bilərək durmuşdular. Dərin bir görüş ilə (bidətlərdən) uzaq durmuşdular. O, durduqları nöqtəni açığa çıxarmaqda onlar daha güclü idilər. Əgər bu işdə bir fəzilət olsaydı, onu etməyə daha da layiq idilər. Əgər sizlər - *onlardan sonra meydana gəldi* – deyəcək olsanız, şübhəsiz onların yollarına müxalif olan və sünnətlərindən üz çevirəndən başqası bu yeni şeyi ortaya çıxarmış deyildir. Onlar şəfa üçün yetərli olacaq qədərini söylədilər, yetərli qədər söz söylədilər. Onlardan irəli gedən həddi aşmışdır, onlardan geriyə qalan isə qüsur etmişdir. Bir qrup kimsələr onlardan geriyə qaldılar, buna görə də uzaq düşdülər. Bir qrup kimsələrdə geri qaldılar, buna görə də həddi aşdılar. Onlar isə bu iksi arasında heç şübhəsiz doğru bir hidayət üzərində idilər» .

**94.** İmam Əvzai – *rahmətullahi aleyhi* – deyir ki: «İnsanlar səni rədd etsələr də sən sələfin yolu ilə getməyə davam et, səni qınasalarda insanların görüşlərindən uzaq ol. Çünki belə etmiş olsan, sən doğru yolda olduğun halda məsələ sənin üçün açıqlanır» .

**95.** İmam Şafii – *rahmətullahi aleyhi* – deyir ki: «Sünnətə müxalif olaraq haqqında söz söylədiyim nə qədər məsələ varsa mən ondan həyatımda da, ölümümdən sonra da vaz keçirəm» .

**96.** Sufyan əs-Souri – *rahmətullahi aleyhi* – deyir ki: «İblis bidəti günahdan daha çox sevir. Çünki günahdan tövbə edilir, bidətdən isə tövbə edilməz» . Günah edən kimsə günah etdiyini bildiyi üçün tövbə etməsi və günahları səbəbilə məğfirət diləməsi umulur. Bidət sahibi isə itaət və ibadət içərisində olduğuna inanır. Tövbə də etməz. Məğfirət də diləməz. İblisdən nəql edilən: «Adəm oğullarının belini günahlarla qırdım. Onlar isə tövbə etməklə, məğfirət diləməklə belimi qırdılar. Mən də onlar üçün məğfirət diləmələri, tövbə etməyəcəkləri günahlar ortaya qoydum. Bunlar isə ibadət şəkilində olan bidətlərdir.

**97.** İmam Əhməd – *rahmətullahi aleyhi* – deyir ki: «Bizə görə sünnətin əsasları Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in səhabələrinin izlədiyi yola sarılmaq, onlara uymaq və bidətləri tərk etməkdir. Çünki hər bir bidət yol azmaqdır» .

**98.** Qazı Şureyh – *rahmətullahi aleyhi* – deyir ki: «Sünnə sizin qiyasınızdan da əvvəldir. Elə isə Sünnəyə tabe o, bidətçi olma» .

**99.** İmam Əhməd b. Sinan əl-Kattan – *rahmətullahi aleyhi* – deyir ki: «Dünyada nə qədər bidətçi varsa mütləq hədis əhlinə ağız əyər. Çünki adam bidət ortaya qoydumu qəlbindən hədisin ləzzəti sökülüb alınır» .

---

1819 Əbu Davud «Sünnən».
1820 İbn Qudamə «Lumatul Etiqadi Hədi İlə Səbili Rəşad»
1821 Xatib «Şərəfu Əshəbi Hədis».
1822 Xatib «Fakibu vəl Mutəfəkkib».
1823 Bəğavi «Şərhu Sunnə».
1824 Laləkai «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Cəmaat».
1825 Darimi 1/66, əl-Bəğavi «Şərhu Sünnə» 1/126.
1826 Nəvəvi «ət-Təzkirə».

**100.** Fudayl b. İyad – *rahmətullahi aleyhi* – deyir ki: «Hidayət yollarına uy. O, yolu izləyənlərin azlığının sənə zərəri yox. Əyri yollardan isə çəkin. Həlak olanların çoxluğuna da aldanma» .

**101.** Sələflər deyillər ki, bağlılığın şəxslərə deyil, dinə olsun. Çünki haqq qalandır, şəxslər isə gedəndir. Haqqı bill, haqq əhlini də bilərsən.

**102.** Abis b. Rabia dedi ki: «Mən Ömər - *radıyallahu anhu* – nu Həcərul Əsvədi öpərkən belə dediyini eşitdim: «Mən sənin fayda verməyən, zərəri olmayan bir daş olduğunu çox yaxşı bilirəm. Əgər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in səni öpərkən görməmiş olsaydım, mən də səni öpməzdim» .

**103.** Muhəmməd b. Sirin – *rahmətullahi aleyhi* – deyir ki: «Bir kimsə əvvəlkilərin izini (yolu) üzərə yürüməyə davam etdikcə, doğru yol üzərində yürüməyə davam edir deməkdir» .

**104.** İmam Məlik – *rahmətullahi aleyhi* – deyir ki: «Bidətlərdən çəkinin». Bidət nədir? Deyə soruşulduqda. O: «Bidətçilər Allahın isimləri, sifətləri, kəlamı, elmi və qüdrəti haqqında danışıb duran, səhabələrin və gözəl bir şəkildə onlara tabe olanların susduqları (mövzuda) yerdə susmayan kimsələrdir» .

**105.** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Böyüklərimizə hörmət etməyən, kiçiklərimizə rəhm etməyən və alimlərimizin haqqını ödəməyən bizdən deyildir» .

**106.** ***«Ey iman gətirənlər! Sizə bəlli olunca qanınızı qaraldacaq şeylər barəsində soruşmayın».*** *(əl-Maidə 101).* ***«Elə isə bilmədiyin bir şeyi Məndən istəmə. Sənə cahillərdən olmamağı nəsihət edirəm».*** *(Hud 46).* ***«Bir baxın siz o, kimsələrsiniz ki, bildiyiniz şeylər barəsində mübahisə edirsiniz. Bəs bilmədiyiniz şeylər barəsində niyə mübahisəyə girişirsiniz. Əlbəttə*** *(həqiqəti)* ***Allah bilir, siz bilmirsiniz».*** *(Ali İmran 66).* Şabi – *rahmətullahi aleyhi* – deyir ki: «Bilmirəm demək elmin yarısıdır». İmam Əhməd – *rahmətullahi aleyhi* – dən insanların fikrincə hər şeyi bilən alim barəsində soruşdular. O: «İnsanların bütün suallarına cavab verən şəxs məcnundur». İbn Sirin – *rahmətullahi aleyhi* – deyir ki: «İnsanın cahil (savadsız) kimi ölməsi onun üçün bilmədiyini danışmasından daha xeyirlidir». Səd b. Cubeyr – *rahmətullahi aleyhi* – deyir ki: «Vay olsun bilmədiyinə bilirəm deyən hər bir kəsə» .

**107.** Həsənul Bəsri – *rahmətullahi aleyhi* - deyir ki? «Sizdən birinizin elm öyrənməyi yalnız Alimdir deyilsin deyə olmasın». İbn Sirin – *rahmətullahi aleyhi* – dən bir şey soruşduqda rəngi dəyişərdi». Nəsəi – *rahmətullahi aleyhi* - dən bir şey soruşduqda ikrah hissi oyanardı və deyərdi: «Soruşmağa məndən başqa adam tapmadın». İmam Məlik – *rahmətullahi aleyhi* - deyir ki: «Bir şey soruşulduqda elə bil ki, Cənnət və Cəhənnəm arasında durmusan. Sənin fikrin onu tez başından uzaq etmək olmasın. Dərdin özünü necə xilas etmək olsun. Özün üçün Qiyamət günü bir çıxış yolu olacaqsa onda danış, əks halda sus».

**108.** Sələflər deyərdilər: «Elm rahat bədənlə əldə edilməz. Rahatlıq yalnız yorğunluqla əldə edilir. Nemətlərə çatmaq yalnız o, yolda olan çətinliklərə dözməklə olur. Bu rahatlığa yalnız Cənnətdə çatılır». Rabi b. Xuseym – *rahmətullahi aleyhi* – yə

[1827] Şatibi «əl-İtisam».
[1828] Buxari, Müslim.
[1829] Laləkai «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Cəmaat».
[1830] Bəğavi «Şəhu Sunnə» 1/217.
[1831] Musnəd 5/323, Mustədrək 1/211.
[1832] «Ədəbuş Şəriyyə» 2/64-69, «Məalimu Fi Tarixi Tələbəi Elm» s. 207,208.

deyirlər ki: «Öz nəfsinə bir az rahatlıq ver». O: «Mən onun rahatlığını istəyirəm» dedi. İmam Əhməd – *rahmətullahi aleyhi* – dən nə vaxt rahatlıq tapırlar. O: «Birinci ayağını Cənnətə qoyduğun zaman». Sələflər deyərdilər: «Dünya var ikən mən yox idim. Dünya qaldığı zaman mən olmayacağam. Buna görə də istəmirəm ki, günlərim zay olsun».

**109.** Cəfər b. Muhəmməd deyir ki, mən Quteybənin belə dediyini dinlədim: «Bir kimsənin Yəhya b. Səid, AbdurRahman b. Mehdi, İmam Əhməd, İshaq b. Rahaveyh və s. zikr edərək – hədis əhli olan kimsələri sevdiyini görsən heç şübhəsiz ki, o kimsə sünnəyə uyan birisidir. Onlara müxalif olan kimsə də bil ki, o bidətçi birisidir».

**110.** Həsənul Bəsri – *rahmətullahi aleyhi* – deyir ki: «Bir kimsə əgər ilk gedənlərə (sələfə) yetişənlərdən olsaydı və sonra bu gün dirilmiş olsaydı İslamdan tanıdıq bir şey görməzdi. Bu namaz müstəsna».

**111.** İbn Sirin – *rahmətullahi aleyhi* – deyir ki: «Həm bir bidəti qəbul edib, həm də bir sünnəyə əməl edən heç kimsə ola bilməz».

**112.** Əli - *radıyallahu anhu* – deyir ki: «İnsanlarla onların başa düşdükləri tərzdə danışın. Əgər Allah və Rəsulunun təqzib olunmasını istəmirsinizsə».

**113.** İmam Əhməd – *rahmətullahi aleyhi* – ilə məkkədə İbn Quteylə Əshəbul Hədisdən söz açınca: «Əshəbul Hədis pis bir topluluqdur» dedi. İmam paltarını silkələyərək qalxdı və: «O, zındıq birisidir, zındıq birisidir» sözlərini evə girənədək təkrar etdi.

**114.** Həsənu Bəsri – *rahmətullahi aleyhi* – deyir ki: «Qorxu və ümüd möminin iki miniyidir».

**115.** Fudayl b. İyad – *rahmətullahi aleyhi* – deyir ki: «Mömin az danışar, çox iş görər. Münafiq isə çox danışar, az iş görər. Möminin danışması hikmətdir, susması təfəkkürdür, baxışı ibrətdir, işi gücü yaxşılıq etməkdir. Belə olduğu zaman daima ibadət içində olmuş olursan».

**116.** Malik b. Dinar – *rahmətullahi aleyhi* – deyir ki: «Möminin misalı harada olursa olsun gözəlliyi yanında olan inci kimidir».

**117.** Vəhb b. Munəbbih – *rahmətullahi aleyhi* – deyir ki: «Mömin öyrənmək üçün başqalarına qarışar, səhf etməmək üçün sükut edər, başa düşməsi üçün danışar, rahat və hüzur içində olmaq üçün tək qalar».

**118.** Muhəmməd b. Munkə – *rahmətullahi aleyhi* – deyir ki: «Allah mömin qulu ilə birlikdə onun uşağını və uşağının uşağını da qoruyar. Onun evini də ətrafdakı evləri də qoruyar. Mömin qul onların arasında olduğu müddətdə onlar daima qorunma içindədirlər».

**119.** Əbul Aliyə – *rahmətullahi aleyhi* – deyir ki: «İslamı doğru olaraq və ən gözəl bir şəkildə öyrənin! Öyrəndikdən sonra da əsla onun sağına və soluna sapmayın! Sıratal-Mustaqim üzərində israrlı və qərarlı olun! Peyğəmbərimizin və səhabələrin

---

[1833] Laləkai «Şərhu Usulu Etiqad Əhli Sünnəti vəl Cəmaat».
[1834] İbn Vaddah «əl-Bidau vən Nəbiyyu».
[1835] Darimi 1/69, İbn Batta «Şərhu əl-İbanə» səh 133.
[1836] Buxari 1/95.
[1837] əl-Bərbəhari «Şərhu Sunnə».
[1838] İmam Əhməd «Zuhd» 2/238.
[1839] Əbu Nuaym əl-Əsfəhani «Hiylətul Övliya» 3/98.
[1840] Əbu Nuaym əl-Əsfəhani «Hiylətul Övliya» 2/377.
[1841] Əbu Nuaym əl-Əsfəhani «Hiylətul Övliya» 4/68.
[1842] Əbu Nuaym əl-Əsfəhani «Hiylətul Övliya» 3/148.

Sünnət üzərində yürüdükləri yoldan əsla ayrılmayın. İnsanlar arasında ayrılıq və sapıqlıqlara səbəb olan nəfsi istəklərdən, bidətlərdən çəkinin» .

**120.** Abdullah - *radıyallahu anhu* – deyir ki: «Sünnət üzərə olub az əməl etmək, bidət üzərə olub çox əməl etməkdən daha xeyirlidir» .

**121.** Zuhri – *rahmətullahi aleyhi* – deyir ki: «Sünnətə sımsıxı sarılmaq qurtuluşdur» .

**122.** Tirmizi – *rahmətullahi aleyhi* – deyir ki: «Elm əhlinin nəznində Cəmaat – fiqh, elm və hədis əhlidir» . İbn Sinan – *rahmətullahi aleyhi* – deyir ki: «Onlar, elm əhli və (səhabələrin) nəql etdiklərinə sahib olanlardır» .

**123.** əl-Əsbəhani – *rahmətullahi aleyhi* – deyir ki: «Səhih sənədlərlə Allah Rəsulu – *sallallahu aleyhi və səlləm* – dən bizə gələn xəbərləri bir-birindən nəql edərək bizə çatdıran hədis hafizlərinə, hədis əhli deyilir. Onlar hədisi öyrənməyə digər insanlardan daha çox istəkli olan, onunla əməl etməkdə, səhih olanlarına ən yaxşı şəkildə uyan, Kitab və Sünnətə əməl edən kimsələrdir. Allahın Rəsulunun sünnətini bir yerə toplamaq üçün ölkə-ölkə dolaşan insanların sadəcə hədis əhlindən olduğunu görürük. Onlar hədisləri qaynaqlarından aldılar. Onları əzbərləyərək də qorumuş oldular. Sünnətlə iftixar edib ona uymağa dəvət etdilər. Ona zidd hərəkət edənləri isə ayıbladılar. Beləcə hədis onların qeyrəti ilə qorundu və onlar da bu adla məşhur oldular» .

**124.** Qudeyf b. əl-Həris – *rahmətullahi aleyhi* – deyir ki: «Bir bidət ortaya çıxan kimi mütləq sünnədən o, qədəri tərk edilir» .

**125.** İmam Məlik – *rahmətullahi aleyhi* – deyir ki: «(Bidət fikirlərinə) dəvət edən Qədəriyyə, Xəvariclər və Rafizilərin şahidliyi caiz deyildir» .

**126.** Sələflər deyirlər ki: «İslamın ayağı yalnız təslimiyyət körpüsü üzərində sağlam olar» .

**127.** İmam Şafii – *rahmətullahi aleyhi* – deyir ki: «Mən Allaha və Allahın muradı üzərə Allahdan gələnlərə, Rəsulullah və Rəsulullahın muradı üzərə Rəsulullahdan gələnlərə iman etdim» .

**128.** İmam Məlik – *rahmətullahi aleyhi* – deyir ki: «Kəlam bir elm olsaydı əshab və tabiin də əhkam haqqında danışdıqları kimi o, haqda da danışardılar. Lakin bu bir batilə dəlalət edən bir batildir» .

**129.** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir nəfər ətrafında toplanmış olduğunuz halda sizin birliyinizi pozmaq istəyərək cəmaatınızı dağıtmaq istəyərək gələn kimsəni öldürün» .

Bunlar Əhli Sünnə vəl Cəmaat, Sələfi Salihin imamlarından olan bəzilərinin söylədikləri sözlərdir. İnsanlar arasında ümmətlərinin ən çox xeyrini istəyən,

---

[1843] İbn Batta «əl-İbanə» 1/299.
[1844] Laləkai «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Cəmaat» 1/55.
[1845] Laləkai «Şərhu Usuli Etiqadi Əhli Sünnə vəl Cəmaat» 1/56.
[1846] Tirmizi 4/465.
[1847] Bağdadi «Şərəfu Əshəbul Hədis» s. 26-27.
[1848] Huccətu fi Bəyani Məhiccə s. 166-167.
[1849] İbn Batta «Şərhu əl-İbanə» səh 143.
[1850] Kadi İyad «Tərtibul Mədarik» 2/47.
[1851] Bəğavi «Şəhu Sunnə» 1/171.
[1852] İbn Qudamə əl-Məqdisi «Lumatul Etiqadi İlə Səbilir Rəşad».
[1853] Bəğavi «Şərhu Sunnə».
[1854] əl-Albani «Səhihul Cəmi» 5820.

ümmətlərinə ən çox xeyirləri toxunan, onların nə ilə düzəldiklərini, harada hidayət tapacaqlarını ən yaxşı bilənlər onlardır. Onlar Allahın Kitabı və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sünnətinə sımsıxı sarılmağı tövsiyə edən, sonradan ortaya çıxmış işlərdən bidətlərdən çəkindirməkdə, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in onlara xəbər verdiyi şəkildə qurtuluş yolunu bildirməkdədirlər. Bu yol isə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sünnətinə və hidayətinə sımsıxı yapışmaqdır. Allah bizi də onlardan etsin. Amin!

# SON SÖZ

Bu ümmətin ilk nəslinin Tövhid əqidəsi budur. Bu əqidə olduqca saf və sağlam bir əqidədir. Kitab və Sünnətin yolu bu ümmətin sələfinin (keçmişinin) görüşləri ilə imamlarının getdiyi yola uyğun, doğru və sağlam bir yoldur. Bu ümmətin ilk nəslinin qəlblərini dirildən yol da bu yoldur. Müsəlmanların birlikdə olmaları və vahid bir din altında birləşmələri yalnız Tövhid əqidəsini gözəl bilmələri ilə mümkündür. Bizim islah olunmağımız, dəvətimizin yayılması üçün - dəvətimizi, əməlləimizi, əxlaqımızı Tövhid əqidəsi üzərində ucaltdıqca mümkün ola bilər. Tərtəmiz əqidə isə bu ümmətin Sələfi olan ilk nəslin inandığı əsaslardır. Əmirul Muminin Əli b. Əbu Talib - *radıyallahu anhu* – deyir: «Bu elmi kimdən öyrəndiyinizə fikir verin, çünki bu elm dinin özüdür» .

Müsülman qardaş və bacılarım! Allah bizi də sizi də doğru yola yönəltsin. Bunu da bilin ki, Allahın kitabı, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Sünnəti və Səhabələrin anlayışından başqa bir yerdə hidayəti axtaran yaxud Allahın qoyduğu şəriətdən başqa bir şəriət ortaya çıxardan kimsə, heç şübhəsiz ki, açıq bir azğınlıq içindədir, doğru yoldan uzaqdır, möminlərin izlədikləri yoldan başqa bir yolu izləməkdədir. İmama Məlik - *rahmətullahi aleyhi* – deyir ki: «Dinin ən xeyrli olanı sünnət olanıdır, ən pis işlər isə sonradan ortaya çıxmış bidətlərdir .

Müsəlmanların birlik olmalarının yolu əqidə birliyindən keçdiyində heç bir şəkk-şübhə yoxdur. Tərtəmiz əqidə isə bu ümmətin sələfi olan ilk nəslin inandığı əsaslardır. Uca Allahın bizə bağlanmağı əmr etmiş olduğu doğru yol və sağa-sola sapmayan yol budur. ***«Bu şübhəsiz ki, mənim doğru yolumdur. Onu tutub gedin. Sizi Allahın yolundan sapdıracaq yollara uymayın. Allah bunları sizə tövsiyə etdi ki, bəlkə pis əməllərdən çəkinəsiz».*** *(əl-Ənam 153).*

Allah – *subhənəhu və təalə* – dən Sələfi Salihin yolunu bizə göstərdiyi kimi bizi də onlardan etməsini, yaratdıqlarının ən xeyirlisi olan Muhəmməd – *sallallahu aleyhi və səlləm* – ilə birlikdə Qiyamət günü həşr etməsini, bizi hidayətə yönəltdikdən sonra qəlbimizi saptırmamasını, onun yolunda çalışan Muvahhid və saleh qullarından etməsini diləyirəm. O, hər şeyi eşidən və duaları qəbul edəndir. Amin! Allahın salat və salamı onun Peyğəmbəri Muhəmməd - *sallallahu aleyhi və səlləm* - ə, onun ailə üzvlərinə, səhabələrinə və Qiyamətə qədər onun yolu ilə gedən saleh möminlərin üzərinə olsun.

***Diqqət!*** - Müsülman qardaş və bacılarım! Bir şeyi sizə nəsihət etmək istəyirəm ki, əksər hallarda kitabın müəllifi bir tərəfə qala-qala onu (kitabı) tərcümə edənin və ya toplayanın adı ilə bağlayırlar. Bu da müəllifin haqların tapdalamaq deməkdir. Allah buyurur: ***«Söz söylədiyiniz zaman ədalətli olun!».*** *(əl-Ənam 152).* Şeyx Useymin –

---

[1855] əl-Hətib «əl-Kifayə fi İlmir Rivayə» s 196.
[1856] İmam Şatibi «əl-İtisam».

*rahmətullahi aleyhi* – deyir ki: «Vacib olan hər bir haqq sahibinə haqqının verilməsidir» . Buna görə də hər bir kitabı onun müəllifinin adı ilə tanımaq ədalətli olmağa daha yaxındır. Mənim tərcümə edib topladığım bu kitabın müəllifləri isə kitabın sonunda: «İstifadə olunan ədəbiyyat» bölümündə qeyd etdiyim kitabların müəllifləridir. Xahiş edirəm ki, bu kitabları mənim adım ilə bağlamayasınız.

***Bitirdim: Hicri 1426-Ci İl 28 Ramazan***
***Miladi 2005-Ci İl 1 Noyabr***
***Həmd Olsun Aləmlərin Rəbbi Olan Allaha. (Yunus 10).***

[1857] Likaul Bədil Məftuh 6/21,22.

# İSTİFADƏ OLUNAN ƏDƏBİYYAT


«Qurani Kərim» Ziya Bünyadov və Vasim Məmmədəliyevin tərcüməsi.
«Sələsətil Usul» Məhəmməd b. Saleh əl-Useyminin şərhi ilə - Türk Dilində.
«Kəşfi Şubuhət» Məhəmməd b. Saleh əl-Useyminin şərhi ilə - Türk Dilində.
«Fəthu Rabbil Bəriyyə Bi Təlhisil Həməviyyə» Məhəmməd Saleh əl-Useyminin şərhi ilə - Türk Dilində.
«Aləmus Sunnətul Mənşura» Hafiz b. Əhməd əl-Həkəmi - Türk dilində.
«əl-Vəciz Fi Əqidətul əs-Sələfi əs-Salihin» Abdullah b. Abdulhəmid əl-Əsəri - Türk Dilində.
«əl-Əqidətul Təhaviyyə» İbn Əbil İzz əl-Hənəfinin şərhi ilə - Türk Dilində.
«əl-Əqidətul Təhəviyyə əl-Muyəssər» Məhəmməd əl-Humeyyisin şərhi ilə - Türk Dilində.
«əl-Əqidətul Vasitiyyə» İbn Teymiyyə. Məhəmməd Xəlil Hərrasın şərhi ilə - Türk Dilində.
«Ərbəin ən-Nəvəviyyə» Nazim Məhəmməd Sultanın şərhi ilə - Türk Dilində.
«Səhih Müslim» - Türk Dilində.
«Muxtəsər Səhih Buxari» - Rus və Türk Dillərində.
«Sünnə Və Cəməa Anlayışı» Nəsir b. AbdulKərim əl-Əql - Azəri dilində.
«Zədul Məad» İbn Qeyyim - Türk Dilində.
«Qurani Kərim Və Səhih hədislərdə İslam Və İmanın Dayaqları» Məhəmməd b. Cəmil Ziynu - Azəri Dilində.
«Quranı Necə Anlamalı» Məhəmməd Cəmil Ziynu - Azəri Dilində.
«Əhli Sünnə Vəl Cəmaatın Etiqadi Özəllikləri» Məhəmməd Abdulhadi əl-Misiri - Türk Dilində.
«Əhli Sünnətə Görə İman» Abdullah b. Abdulhəmid əl-Əsəri - Türk Dilində.
«İman Üzərinə» İbn Teymiyyə - Türk Dilində.
«Cənnət Əhli Və Əhvalı» Yaşar Süleymanlı.
«Cəhənnəm Əhli Və Əhvalı» Yaşar Süleymanlı.
«Fikhus Sıra» Əhməd Fərid - Türk Dilində.
«Ən Gözəl Örnək Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dir» Səfiyyurahman Mubarakfuri - Türk Dilində.
«Xatəmul Ənbiya» Əli Hikmət Bərki, Osman Kəskioğlu.
«Peyğəmbərimizin Kişisel Və Əxlaqi Özəllikləri» Məhəmməd Cəmil Ziynu - Türk Dilində.
«Şəfa Duaları Və Ovsunlar» Səid əl-Qahtani - Azəri dilində.
«İtiqadu Əimmətus Sələf» Muhəmməd əl-Humeyyis - Türk Dilində.
«Esmaül Hüsnə» İbn Kayyim El-Cevziyye - Türk Dilində.
«Esmaül Hüsnə» İbni Kesir, Kurtubi, Beyhəki, əs-Sadi, İbn Kayyim El-Cevziyye, Əbu Süleyman əl-Hattabi, Rağib İsfehani - Türk Dilində.
«Судба и Предопределение» Умар Сулейман ал-Ашкар – Перевод с Арабского Э.Р.Кулиева.
«Идеальные Правила, Относящиеся К Прекрасным Именам И Качествам Аллаха». Мухаммад б. Салих аль-Усеймин, Перевод с арабского Кулиева Эльмира Рафаэль оглы.
«Hədiyul Ərvah - Cennetdeki Hayat» İbn Kayyim El-Cevziyye - Türk Dilində.
"Mutəqid Əhli Sünnə Vəl Cəmaat Əsməilləhi Vəl Husnə" Muhəmməd İbn Xəlifəti ət-Təmimi - Ərəb Dilində.
"Имена Аллаха" Саид аль-Кахтани - Rus Dilində.
"Где Аллах?" Абу Абдурахман Дагестани - Rus Dilində.
"İslâm Itikadinda İsim Ve Sifat" AbdurRahman AbdulXaliq - Türk Dilində.
"Милостивый Вознесся На Трон" Абу Али Абдуллах - Rus Dilində.
"Лицезрение Аллаха" Абу Али Абдуллах - Rus Dilində.
«Elmin fəziləti» Əlixan Musayev.
Adil Rəvəbov qardaşımızın «İman» dərsləri.

# MÜNDƏRİCAT